*Bu kitab "Azərbaycan dilinin izahlı lüğəti" I cild (Bakı, Azərbaycan Elmlər Akademiyası nəşriyyatı, 1966), II cild (Bakı, Elm, 1980), III cild (Bakı, Elm, 1983) və IV cild (Bakı, Elm, 1987) nəşrləri əsasında təkrar nəşrə hazırlanmışdır*

Azərbaycan Milli Elmlər Akademiyasının müxbir üzvü,
filologiya elmləri doktoru, professor
**Əliheydər Orucovun**
rəhbərliyi və ümumi redaktəsi ilə

Tərtibçilər:

**Əliheydər Orucov, Bəhruz Abdullayev, Nərgiz Rəhimzadə**

Nəşrə hazırlayanı, təkmilləşdirəni və redaktoru:

Azərbaycan Milli Elmlər Akademiyasının müxbir üzvü
filologiya elmləri doktoru, professor
**Ağamusa Axundov**

**494.36131-dc21**
**AZE**
**Azərbaycan dilinin izahlı lüğəti.** Dörd cilddə. III cild. Bakı, "Şərq-Qərb", 2006, 672 səh.

**ISBN10 9952-34-025-7**
**ISBN13 978-9952-34-025-9**

# Qq

**Q** Azərbaycan əlifbasının on yeddinci hərfi. bax **qe**.

**QA** *təql.* Qarğanın çıxardığı səs. *Böylə sözdən fərəhlənib qarğa; Ağzını açdı, ta ki etsin qa!* M.Ə.Sabir.

**QAAN** *is. tar.* Türk, monqol və tatar xanları üçün "hökmdarlar hökmdarı" mənasında işlədilən ünvan; xaqan.

**QAB** *is.* 1. İçərisinə şey qoymaq və ya içərisində şey saxlamaq üçün məişət avadanlığı. *Saat qabı. Şeyləri qoymaq üçün qab lazımdır. – Qəzəl qurtarmayır, çatmayır sona; Qoyub qələmini davat qabına..* B.Vahabzadə. // *dan.* Çuval, torba, kisə, yeşik və s. *Buğdanı bir qaba tök.*

2. İçərisinə yemək qoyulan, yemək tökülən boşqab, mətbəx əşyası və s. *Şorbanı qablara tökmək.* – [Cahandar ağa:] *Ay bacı, atan ehsanına bir qab su ver, içim..* İ.Şıxlı.

◊ **Qabına sığmamaq** – 1) səbirsizlik göstərmək, özündən çıxmaq (şadlıqdan); 2) güvənmək, lovğalanmaq, qürrələnmək. **Qabında bir şey olmamaq** – elmsiz, məlumatsız, biliksiz, qabiliyyətsiz, bacarıqsız adam haqqında. *Görünüşünə baxma, qabında bir şey yoxdur.* **Qabını çatlatmaq** – həddini ötüb keçmək, cığırını aşmaq, daşıb dağılmaq. *Sirkə tünd olsa, öz qabını çatladar.* (Ata. sözü).

**QABA** *sif.* 1. Kobud, sərt, cod. *Qaba yun. Qaba parça. Qaba mahud. Qaba yem.*

2. Qeyri-mədəni, ədəbsiz, nəzakətsiz, kobud; tərbiyəyə zidd. *Qaba söz. Qaba zarafat. Qaba hərəkət. Qaba rəftar. Qaba* (z.) *danışmaq.* – [Feldşer] *çox uzunçu, lağlağı, həm də qaba bir adam idi.* M.Hüseyn.

**QABAĞARDAN** *is. dan.* Qalayçı.

**QABAQ**[1] *is.* 1. *bot.* Qarpız, qovun və xiyar cinsindən, yerə yayılan iriyarpaqlı bir bitkinin uzunsov, ya girdə, sarımtıl və ya yaşıl meyvəsi; balqabaq, kudu. *Qabaq tağı şamama verməz.* (Ata. sözü).

2. *məc. dan.* Dadsız, tamsız qovun, qarpız və s. haqqında. Bir *qovun kəsdik, lap qabaq çıxdı.*

**QABAQ**[2] 1. *zərf* Əvvəl, irəli. *Üç gün bundan qabaq gəlmişəm. – Bir ay bundan qabaq övrətim və uşaqlarımı da götürüb Ağdamdan Bakıya köçürmüşəm.* C.Məmmədquluzadə. *Məmməd şirin səhər yuxusuna xələl qatar, işə vaxtından da yarım saat qabaq gələrdi.* M.İbrahimov. // Tez. *Hamıdan qabaq kim gəldi? – Ey günəş üzlü yar, günəşdən qabaq; Yoluma nur çilə, gəl səhər-səhər.* M.Araz.

2. *sif.* Əvvəlki, keçmiş. *Qabaq zaman.* // Cəm şəklində: **qabaqlar** – əvvəllər, keçmişdə. *Qabaqlar bura ağaclıq idi. Qabaqlar o çox gözəl oxuyardı. – Özlərinin qabaqlar zülm etdikləri; Məzlumlar da yəqin həmin cür olublar.* Şəhriyar.

3. *is.* Bir şeyin irəli tərəfi, ön tərəfi, üz tərəfi (*dal* müqabili). *Binanın qabağı bağa çıxır. Paltarımın qabağı batmışdır. – Dörd-beş mərtəbəli evlərin qabağından Vətən müharibəsi qəhrəmanlarının şəkilləri asılmışdı.* M.Hüseyn. // *sif.* İrəlidə olan, ön tərəfdə olan; ön. *Arabanın qabaq çarxı. Müdafiənin qabaq xətti. Kitabın qabaq səhifələri düşmüşdür.* – [Nəcəf] *düşmənin ən qabaq və ən son istinadgahında dayanmışdır.* Mir Cəlal. // İrəlidə gedən, qabaqda gedən. *Nəhayət, kəndlilərin qabaq dəstəsi gəlib çatdı.* M.Hüseyn.

4. Qoşma mənasında yerlik halında: **qabağında** – qarşısında, önündə, qənşərində. *Şagird müəllimin qabağında durub suallara cavab verirdi. Məktəbin qabağında iki sıra ağac əkilmişdir. Avtomobil evimizin qabağında durdu. – Sona hər axşam pəncərənin qabağında oturub yola baxır və günəşin batan tellərini ılıq göz yaşları ilə isladırdı.* C.Cabbarlı. *Daxmanın qabağında topa-topa adamlar... Hər gözdə bir sual var.* B.Vahabzadə.

5. *zərf* İrəli. *Fatma ağzına yaşmaq çəkib, utana-utana qabağa yeridi.* Mir Cəlal.

6. *is.* Ön tərəf, irəli tərəf, qarşı tərəf. *Qabağımız dərə idi, dalımız dağ. – Nahardan sonra Bahadır pəncərədə oturub qabağındakı meşəyə tamaşa edirdi.* N.Nərimanov. *Yavaş-yavaş dumduru göy qabağının və geniş üfüqlərin əzəmətli mənzərəsi açılırdı.* M.İbrahimov. // Qarşı. *Əlacım hər tərəfdən kəsildi, bir təbəqə kağızı qoydum qabağıma, dedim: – İndi söylə, mən yazım.* Qantəmir.

7. Alın. *Büllur buxaq, lalə yanaq, ay qabaq; Şahmar zülfü pərişanlar dolanır*. Aşıq Ələsgər.

◊ **Qabağa düşmək** – 1) rəhbərlik etmək, yol göstərmək. *Qabağıma düş, məni oraya apar*. – [Gülməmməd:] *Məgər bilmirsən ki, camaat işlərində həmişə qabağa düşən Mirzə Kərimdir?* Ə.Haqverdiyev; 2) irəli düşmək, bir işdə təşəbbüsçü, birinci olmaq, baş olmaq, başqalarını ötmək. *Bizim briqada yenə qabağa düşdü*. **Qabağa getmək** – irəliləmək, inkişaf etmək, artmaq. [Ağa Məhəmməd xan:] *İşin qabağa getməyi üçün, əvvəl, vacib dost qazanmaqdır*. Ə.Haqverdiyev. **Qabağa gələn** – ağsaqqal, sözü keçən, hörmətli. *Kəndin qabağa gələnləri*. **Qabağa keçmək** – başa keçmək, birinci yeri tutmaq. *Şamxal bunu duymuş kimi qabağa keçib axşam ayazında tir-tir əsən Güləsərin qolundan tutdu..* İ.Şıxlı. **Qabağı açılmaq** – 1) üzü gülmək, üzündə sevinc əlaməti görünmək. *Bu sözü eşidən kimi, onun qabağı açıldı. Nə var, nə olmuş, heç qabağın açılmır?* 2) axın halında, izdihamla gələn, hərəkət edən kütlə haqqında. *Sürünün qabağı açıldı. Qoşunun qabağı açıldı*. **Qabağına ağac uzatmaq** – qarşısını saxlamaq, mane olmaq, qoymamaq. **Qabağına çəkmək** – özünə lap yaxınlaşdırmaq. *Həsən kişi tünd çay dolu stəkanı qabağına çəkdi*. M.İbrahimov. **Qabağ(ın)a çıxmaq** – 1) qarşılamaq; səfərdən gələn adamın qarşısına getmək. *Sara xanım toya gələndə kənd ağsaqqallarının bütün arvadları onun qabağına çıxırdı*. Qantəmir. *Hər axşam Şaban evə gələndə xəyal edirdi ki, Gülsüm həmişəki tək onun qabağına çıxıb əlinə su tökəcək*. Ə.Haqverdiyev; 2) təsadüf etmək, rast gəlmək; 3) yolunu kəsmək, qabağını kəsmək. *Budu gördüm, əli tüfənglilər darvazanı kəsdirib sındırırlar. – İmrana elə gəldi ki, buludlar ayı bürüyür, onun qabağına keçir, yol vermək istəmir..* İ.Şıxlı. **Qabağına keçmək** – 1) mane olmaq, əngəl törətmək; 2) yol göstərmək, bələdçilik etmək. **Qabağına kötük itələmək** – b a x **qabağına ağac uzatmaq**. *Əlyarov hər cür yolla işin qabağına kötük itələyir*. M.Hüseyn. **Qabağına qatmaq** – sürmək, aparmaq, qabağına salıb aparmaq, qova-qova aparmaq. *Çoban sürünü qabağına qatıb apardı. – Karvanı gülləyə basıb qırdıqların qırdılar, qırmadıqlarının da qollarını bağlayıb qabaqlarına qatdılar*. Çəmənzəminli. *Buğac üç ceyranı qabağına qatıb düz xana sarı qovurdu*. M.Rzaquluzadə. **Qabağından qaçmaq** – qorxmaq, çəkinmək. **Qabağından yeməyən** – həddindən artıq dikbaş, iddialı, öz həddini, danışığını bilməyən adam haqqında. *Hüseynqulu .. qabağından yeməyən idi, .. söz götürməzdi*. Ə.Sadıq. **Qabağını almaq** – 1) bir hadisənin baş verməsinə mane olmaq üçün vaxtında tədbir görmək, baş verməyə qoymamaq. *Yanğının qabağını almaq. Xəstəliyin qabağını almaq. Təhlükənin qabağını almaq*. – [Ağbulaqlılar] *selin qabağını almaq üçün səddi-Çin kimi qalın-qalın barılar düzəltmişdilər*. S.Rəhimov; 2) qabağını kəsmək. *Küçəni dönərkən bir Çin polisi onun qabağını aldı*. S.S.Axundov. [Əsgər:] *Gedib nemesin qabağını alacağam*. Ə.Əbülhəsən. **Qabağını boğmaq** – b a x **qabağını almaq** 1-ci mənada. **Qabağını kəsmək** – 1) mane olmaq, qarşısını almaq. *Selin qabağını kəsmək*; 2) soyğun və talan məqsədilə yolunu tutmaq, yolunu bağlamaq. *Meşənin qurtaracağına iki verst qalmış bir atlı, yaraqlı adam Cəfərin qabağını kəsdi: – Dayan, tərpənmə, atdan düş, yoxsa odladım*. S.S.Axundov. **Qabağını-gerisini düşünmək** – görüləcək bir iş haqqında ətraflı fikirləşmək, ehtiyatla, sayıq hərəkət etmək. **Qabağını tutmaq** – b a x **qabağını kəsmək**. **Özünü qabağa vermək** – irəli gəlmək, təşəbbüsçü olmaq, birinci olmaq. *Rüstəm özünü qabağa verib bu yerlərə tamamilə bələd olduğunu komandirə bildirdi*. S.Rüstəm.

**qabaq-qabağa** *zərf* Qarşı-qarşıya, üz-üzə, üzbəüz, bir-birinin önündə. *Cəlal və müəllim diz üstə qabaq-qabağa oturub dərs oxuyurlar*. C.Məmmədquluzadə. *Şabanla Gülsüm o gecə sübhədək yatmayıb qabaq-qabağa söhbət etdilər*. Ə.Haqverdiyev. *Bir-iki dövrə vurandan sonra* [Ağca xanım] *Qaraca qızı çağırdı, o da dərhal sıçrayıb ortalığa girdi və hər ikisi qabaq-qabağa oynamağa başladı*. S.S.Axundov. ☐ **Qabaq-qabağa gəlmək** – rastlaşmaq, üz-üzə gəlmək. *Qürbət bir şəhərin bazarında iki adam qabaq-qabağa gəlib bir-birinə zənn ilə baxdılar*. Çəmənzəminli.

**Qabaq-qabağa qoymaq** – qarşılaşdırmaq, tutuşdurmaq.

**QABAQCA** *zərf* Əvvəlcə, əvvəldən, irəlicə, irəlidən. *Mən qabaqca söyləmişdim. Qabaqca hazırlaşmaq lazımdır. – Qabaqca Münəvvər xanım anası ilə görüşürdü: – Ana, salamat qal! Yenə tezliklə sənin ziyarətinə gələrəm*. M.S.Ordubadi. [Kəblə Rəcəbəli:] *Kafir oğlu, bunu mənə qabaqca de, mən də əlimi murdarlamayım*. Ə.Haqverdiyev.

**QABAQCADAN** *zərf* Qabaqdan, əvvəldən, irəlicədən. *Qabaqcadan şərtləşmək. Qabaqcadan xəbər vermək. – Mən bir az tez gəldim ki, qabaqcadan sizi görüm*. C.Cabbarlı. "*Molla Nəsrəddin*"*in bu nömrəsindən Hacı Axund qabaqcadan xəbər tutmuşdu*. Mir Cəlal. *Cavadın qabaqcadan göndərdiyi kəşfiyyat dəstəsi bu top hazırlığının gurultusu altında düşmən cərgələrinə yaxınlaşmışdı*. Ə.Vəliyev.

**QABAQCIL** *sif.* 1. Ən şüurlu, ən gözüaçıq, ən təşəbbüslü; işdə, mübarizədə hamıdan irəlidə gedən, ən fəal. *Cəmiyyətin ən qabaqcıl adamları*. – ["Dəbistan"] *ilk məktəbli jurnalının bağlanması qabaqcıl elm, maarif xadimlərini, vətənpərvər ədib və şairləri kədərləndirmiş, bir çox ədəbi-bədii əsərin başlıca obyektinə çevrilmişdir.* "Hophopnamə". // İs. mənasında. *Neft sənayesi qabaqcılları. Kənd təsərrüfatı qabaqcılları. İstehsalat qabaqcıllarının müşavirəsi.*

2. Öz inkişafına görə o birilərindən daha yüksək səviyyədə olan, ən mütərəqqi, ən irəlidə gedən. *Qabaqcıl elm. Qabaqcıl nəzəriyyə. – Qabaqcıl ziyalılarda bir ruh yüksəkliyi, coşqunluq, ümid hiss edilirdi*. A.Şaiq. *Həsənbəy Zərdabi dövrünün qabaqcıl adamı və Azərbaycan torpağının atəşin vətənpərvəri idi*. M.İbrahimov.

**QABAQCILLIQ** *is.* Hər hansı bir işdə qabaqcıl olma, ön sırada olma; birincilik, təşəbbüsçülük. *İşdə qabaqcıllıq. Dərsdə qabaqcıllıq. Qabaqcıllığı əldən verməmək. – Qorxmazla Zaman işləyənlərə baş çəkir, .. Həqiqətlə Səadətin yanında dayanıb qabaqcıllıq uğrunda söhbət edirdilər*. Ə.Vəliyev.

**QABAQDA** *zərf* 1. İrəlidə, qabaq tərəfdə. *Qabaqda oturmaq*. □ **Qabaqda gedən** – 1) irəlidə gedən; 2) *məc.* yol göstərən, başçılıq edən, rəhbərlik edən. **Qabaqda getmək** – 1) hamıdan irəlidə getmək; 2) *məc.* rəhbərlik etmək, yol göstərmək.

2. Gələcəkdə, irəlidə. *Qabaqda işlərimiz çoxdur. Qabaqda böyük məsələlər var*.

3. Cəm şəklində yerlik halında: **qabaqlarda** – keçmişdə, keçmiş zamanlarda, əvvəllərdə. [Məşədi İbad:] ..*arvad ərindən nə qədər kötək yesə bir o qədər ərin çox istəyər. Mən bunu qabaqlarda çox təcrübə eyləmişəm.* Ü.Hacıbəyov.

**QABAQDAKI** *sif.* Qabaqda, irəlidə olan; qabaqda duran, ya oturan. *Qabaqdakı evlər. – Atları sürüb, qabaqdakı adama yetişdilər.* "Aşıq Ələsgər". // Yaxındakı, irəlidəki. *Qabaqdakı kəndin adı nədir?*

**QABAQDAN** *zərf* 1. Qabaq tərəfdən, ön tərəfdən; qarşı tərəfdən; qarşıdan. *Evin qabaqdan görünüşü. – Mən gedirdim, dostum çıxdı qabaqdan; Acı sözün salmaz məni damaqdan*. "Aşıq Qərib".

2. Qabaqcadan, əvvəlcədən, əvvəldən, çoxdan. *Gəlməyəcəyini qabaqdan bilirmiş. – Axşamdan bəri getməyə tələsən, heybəsini bir gün qabaqdan hazırlayıb səbirsizliklə bu anı gözləyən oğlan birdən-birə qəribsədi.* İ.Şıxlı.

**QABAQGÖRƏN** *sif.* Gələcəyi görən, bəsirətli, açıqfikirli; qabaqcıl, tərəqqipərvər. *Xalqın bütün açıqfikirli, qabaqgörən igid və namuslu oğulları .. alçaq düşmənlərlə öz mübarizəsini daha artıq gücləndirirdi*(*lər*). H.Sarabski.

**QABAQGÖRƏNLİK** *is.* Qabağı görmə, gələcəyi görmə; açıqfikirlilik, bəsirət.

**QABAQKI** *sif.* Əvvəlki, əvvəldə olan, keçmişdə olan. *Qabaqkı məsələ. – Gözəl sonra ikinci uşağı Atabəyə verdi, yenə qabaqkı sözünü təkrar etdi.* M.S.Ordubadi.

**QABAQ-QARŞI** *zərf* Qabaq-qabağa, qarşı-qarşıya, üz-üzə. *Sadıq xanla Məmməd bəyin gözlərinə yuxu getmirdi: qabaq-qarşı oturub sabahın dərdinə qalmışdılar.* Çəmənzəminli. *Güllü .. qoluçirməkli olduğu halda, oğlu ilə qabaq-qarşı durub danışırdı.* Ə.Əbülhəsən.

**QABAQ-QƏNŞƏR** *is.* Qabaq, göz qabağında olan, görünən yer. *Qabaq-qənşər qayalıqda kəklik oxuyur; Var ol səni, xallı pəri, bu təbrik üçün.* M.Araz.

**QABAQLAMA** “Qabaqlamaq”dan *f.is.*

**QABAQLAMAQ** *f.* 1. Bir hadisənin baş verməsinə mane olmaq üçün qabaqcadan tədbir görmək, baş verməyə qoymamaq, qabağını almaq. *Hadisələri qabaqlamaq. – Firidun sərtibi qabaqlamaq üçün addımlarını itiləşdirdi.* M.İbrahimov.

2. Qabağını kəsmək, qabağında dayanıb getməyə qoymamaq. *Cahan istəyir getsin, Soltan bəy tez qabaqlayır.* Ü.Hacıbəyov. *Qədir .. özünü görməməzliyə vurub, yandan ötmək istədi. Sona onu qabaqladı.* Ə.Əbülhəsən.

3. Başqasının etmək istədiyi bir işi ondan qabaq görmək, yaxud söyləmək istədiyi bir şeyi ondan qabaq söyləmək. *Mən deyəcəkdim, lakin o məni qabaqladı. – Qazı istəyirdi ki, ağzını açıb bir söz desin, amma Qasıməli qabaqladı.* C.Məmmədquluzadə. *Gözəl ayağa durub Həbibin yanına gəlmək, onun sağ əlinə diqqətlə baxmaq fikrinə düşəndə, Həbib onu qabaqladı.* Ə.Vəliyev.

4. Ötmək, keçmək. *Budur, aşağıdan üçüncü dolayıdan başıyuxarı iki atlı çapışır. Görək bunların hansı qabaqlayacaq.* C.Məmmədquluzadə.

5. Qabağına salmaq. *Nəzarətçilərdən biri oğrunu qabaqlayıb gətirdi.*

**QABAQLANMA** “Qabaqlanmaq”dan *f.is.*

**QABAQLANMAQ** *məch.* Qarşılanmaq, önlənmək.

**QABAQLAŞDIRMA** “Qabaqlaşdırmaq”dan *f.is.*

**QABAQLAŞDIRMAQ** 1. Tutuşdurmaq, müqayisə etmək.

2. Bir-biri ilə üzləşdirmək, üz-üzə gətirmək.

**QABAQLAŞMA** “Qabaqlaşmaq”dan *f.is.*

**QABAQLAŞMAQ** *f.* Qarşılaşmaq, qarşı-qarşıya gəlmək, üz-üzə gəlmək; üz-üzə durmaq. *Tənbur ilə telli sazı; Qabaqlaşıb çalaq, barı!* S.Vurğun. *Ana-oğul dikdirdə qabaqlaşdılar. Şamxal anasını gözüyaşlı görüb, evdə bədbəxt bir hadisə baş verdiyini zənn etdi.* İ.Şıxlı.

**QABAQLIQ**[1] *is.* 1. Qadınların alınlarına vurduqları qızıl, gümüş və s.-dən bəzək.

2. Döşlük.

**QABAQLIQ**[2] *is.* Qabaq əkilmiş yer.

**QABALAŞDIRILMA** “Qabalaşdırılmaq”dan *f.is.*

**QABALAŞDIRILMAQ** *məch.* Kobudlaşdırılmaq, qaba şəklə salınmaq; zəriflikdən, incəlikdən məhrum edilmək.

**QABALAŞDIRMA** “Qabalaşdırmaq”dan *f.is.*

**QABALAŞDIRMAQ** *f.* Kobudlaşdırmaq, qaba şəklə salmaq; zəriflikdən, incəlikdən məhrum etmək.

**QABALAŞMA** “Qabalaşmaq”dan *f.is.*

**QABALAŞMAQ** *f.* Qaba olmaq; zərifliyini, incəliyini itirmək; kobudlaşmaq, codlaşmaq.

**QABALIQ** *is.* 1. İncəlikdən, zəriflikdən məhrum olma; kobudluq, codluq. *Mahudun qabalığı. Dərinin qabalığı. Tikişin qabalığı dərhal nəzərə çarpır.*

2. Tərbiyəsizlik, ədəbsizlik, nəzakətsizlik; qaba hərəkət, qaba danışıq. *Rəftarın qabalığı. Onun qabalığına adam heyrət edir. – Qolçomaq Dadaşın qabalıqları; Qəhrində əriyib sönür şam kimi; Səhəri dumanlı bir axşam kimi...* M.Müşfiq.

**QABAN** *is.* Vəhşi donuzun erkəyi. *Qaban əti. Qaban ovu. Çöl donuzuna qaban da deyilir. – Kənddən bir dənə biyar araba gətirib, qabanın cəmdəyini içinə yıxıb, özüm də üstündə yola düşdüm.* Ə.Haqverdiyev. // *məc.* Kobud, yekə cüssəli, yöndəmsiz və qüvvətli adam haqqında. *Ərdovdu, qabandı, qoyma gəldi; Didarı yamandı, qoyma gəldi!* M.Ə.Sabir.

◊ **Qabana dönmək** – 1) həddindən artıq yekələnmək, kökəlmək, güclənmək; 2) vəhşiləşmək, azğınlaşmaq; son dərəcə qəzəblənmək, hiddətlənmək. *Dönüb qabana-pələngə, polis idarələri; Girib bu xalq ilə cəngə polis idarələri.* Ə.Nəzmi. **Yaralı qabana dönmək** – b a x **qabana dönmək** 2-ci mənada.

**QABAR** *is.* 1. Bədəndə dərinin altında əmələ gələn sulu qabarcıq; suluq. ☐ **Qabar olmaq** – b a x **qabarlamaq** 1-ci mənada. [Mahmud:] *Balta vurmaqdan qollarım düşdü, əllərim suluq-suluq qabar oldu.* Ə.Haqverdiyev.

2. Çox sürtülməkdən, toxunmaqdan qalınlaşmış, sərtləşmiş ət təbəqəsi; döyənək. ☐ **Qabar bağlamaq, qabar olmaq, qabar çalmaq** – b a x **qabarlamaq** 2-ci mənada.

[Şərəf xanım:] *Gecə-gündüz işləməkdən əllərim qabar olmuşdur.* S.S.Axundov. *Ayaqlarım yolunda qat-qat qabar bağlamış.* R.Rza. *Bəs səbəb nədir, yazmır anaya bircə kağız; Oğul-oğul deməkdən qabar oldu dil, ağız.* S.Rüstəm.

3. Su üzündə yağış damcılarından əmələ gələn köpükcük; qabarcıq.

**qabar-qabar** *sif.* Hər tərəfi qabarlı, qabarla örtülmüş. *Əlləri qabar-qabar* (z.) *olmaq. – Yaralarım qabar-qabar; Gəldi yardan doğru xəbər.* Aşıq Kərəm. *Ayağın qabar-qabar çatdın Tehrana, heyhat*! S.Rüstəm. [Komandir:] *Mən özüm də kənddən çıxmışam, atamın da əli, bax, belə qabar-qabardır.* S.Rəhimov.

**QABARBÖCƏYİ** *is. zool.* İnsan bədəninə toxunduqda və ya əzildikdə dəridə qabar əmələ gətirən bir böcək.

**QABARCIQ** *is.* Kiçik qabar.

**QABARCIQLANDIRMA** "Qabarcıqlandırmaq"dan *f.is.*

**QABARCIQLANDIRMAQ** *f.* Qabarcıqlar əmələ gətirmək.

**QABARCIQLANMA** "Qabarcıqlanmaq"dan *f.is.*

**QABARCIQLANMAQ** *f.* 1. B a x **qabarlamaq** 1-ci mənada. *Əllərimin dərisi qabarcıqlanmışdı, soyulmuşdu, xalam hər iki əlimi qatıqla suvayıb tənziflə bağlamışdı və qabağına salıb həkimə aparmaq istəmişdi, amma mən getməmişdim.* Ə.Məmmədxanlı.

2. Su üzündə yağış damcılarından qabarcıqlar əmələ gəlmək.

**QABARCIQLI** *sif.* Üzərində qabarcıqlar olan, qabarcıqla örtülü.

**QABARDILMA** "Qabardılmaq"dan *f.is.*

**QABARDILMAQ** *məch.* Qabarıq hala (şəklə) salınmaq, şişirdilmək.

**QABARDİN** *is.* [*fr.*] 1. Əsasən palto və kostyum tikmək üçün əla yun parça növü.

2. *Sif. mənasında.* Həmin parçadan tikilmiş. *Qabardin palto* (*kostyum*).

**QABARIQ** *sif.* 1. Qabarmış, şişmiş, səthi hamar olmayan. *Qabarıq şüşə. Qabarıq naxış.* // *is.* Şiş, çıxıntı, ur.

2. *sif.* və *zərf məc.* Nəzərə çarpacaq halda, çox aydın. *Tehran qabarıq bir təzad içərisində öz adi həyatını yaşayırdı.* M.İbrahimov. *Aləmi qatı toz dumanı bürüdü. Qaçay, yolun sinəsindən qabarıq dalğalanan bu ağ-sarımtıl örtüyün içində itdi.* İ.Məlikzadə. *Melodiya musiqi sənətinin bünövrəsi və onun ən qabarıq bir şəkildə eşidilən əsas cəhətidir.* Ə.Bədəlbəyli.

**QABARIQLI** *sif.* Qabarıq şəkildə olan; qabarıq.

**QABARIQLIQ** *is.* Qabarıq şeyin halı.

**QABARILMAQ** b a x **qabardılmaq**.

**QABARİT** [*fr.*] Bir şeyin ölçüsü, böyüklüyü, həcmi.

**QABARLAMA** "Qabarlamaq"dan *f.is.*

**QABARLAMAQ** *f.* 1. Qabar olmaq, suluqlamaq.

2. Döyənək olmaq, bərkimək.

**QABARLANMA** "Qabarlanmaq"dan *f.is.*

**QABARLANMAQ** b a x **qabarlamaq**.

**QABARLATMA** "Qabarlatmaq"dan *f.is.*

**QABARLATMAQ** *icb.* 1. Suluqlandırmaq, qabarlı etmək.

2. Çox sürtməkdən, toxundurmaqdan, əzməkdən bədənin bir yerinin ət təbəqəsini bərkişdirmək, döyənəkləşdirmək.

**QABARLI** *sif.* Qabarla örtülmüş; döyənək. *Atamın fikri və iradəsi də qabarlı əlləri kimi bərk və möhkəmdi.* M.İbrahimov. ☐ **Qabarlı əllər** *məc.* – zəhmətkeşlər, fəhlələr mənasında. *Qabarlı əllər uzanır "Zimni"yə; Köhnə dünyanı birdəfəlik boğmaq üçün.* R.Rza.

**QABARLILIQ** *is.* Qabarlı şeyin halı.

**QABARMA**[1] "Qabarmaq[1]"dan *f.is.*

**QABARMA**[2] 1. "Qabarmaq[2]"dan *f.is.*

2. *is. coğr.* Dəniz suyunun səviyyəsinin vaxtaşırı olaraq qalxması, artması hadisəsi. *Qərbi Avropanın şimal və qərb hissələrində böyük qabarma və çəkilmələr olur.*

**QABARMAQ**[1] *f.* Qabar əmələ gəlmək, qabar olmaq. *Var ol, bala, yorulsa da, qabarsa da əl; Bir daş üstə bir daş qoya gərək hər insan.* Ə.Cəmil. // Bərkimək. [Gəldiyevin] *ürəyi daş kimi bərkimiş, əsəbləri ağac kimi qabarmışdı.* Mir Cəlal.

**QABARMAQ**[2] *f.* 1. Yüksəlmək, qalxmaq, daşmaq. *Dağlarda qarlar əriyincə, çayların suyu qabarırdı. Dənizin sakit səthi ehmalca qabardı. – Birdən sanki üfüq enir, torpaq qabarır; Qarşımızı kəsən dağı bir əl qoparır.* R.Rza.

2. Köpmək, şişmək. *Xəmir qabarır.*

3. Ürpərmək, dikəlmək, dik-dik durmaq, biz-biz durmaq. *Xoruzun tükləri qabardı.*

4. Acıqlanmaq, sərt söz demək. ☐ **Üzə qabarmaq, üstünə qabarmaq** – üzə durmaq, sərt cavab qaytarmaq, acıqlanmaq. *Kərbəlayı Heydər bir dəfə onun* [Zeynəbin] *üstünə qabarmamışdı.* C.Məmmədquluzadə.

5. *məc.* Ruha gəlmək, ruhlanmaq, coşmaq. *Sən coş ki, qabarım mən də səninlə; Aşığam, qoy çalım saz bayramına.* Ə.Cavad. // *məc.* İftixar hissi duymaq, iftixar etmək; son dərəcə sevinmək, ruhlanmaq.

**QABARTI** *is.* Qabarıq, suluq, döyənək.

**QABARTMA** 1. "Qabartmaq"dan *f.is.*

2. *sif.* Çıxıntılı, qabarıq. *Qabartma naxış. Qabartma yazı.* // Qabarıq şəkillərdən, naxışlardan ibarət. *Qəbir .. sandıq şəklində bir daşdan ibarət olub, dörd tərəfində Ceməstin həyati vəqələrini təsvir edən qabartma lövhələr qayrılmışdı.* Çəmənzəminli.

3. *is.* Yastı səth üzərində alçaq qabarıqlı təsvir. *Assuriya qabartmalarına əsasən demək olar ki, Midiyanın qala tikintiləri çox böyük həcmli və eyni zamanda bəzəkli olmuşdur.* Salamzadə.

**QABARTMAQ** *f.* 1. Qabarıq hala salmaq, şişirtmək, köpürtmək.

2. Yüksəltmək, yuxarıya qaldırmaq, daşdırmaq. *Külək dənizin suyunu qabartdı.*

3. Tüklərini ürpərtmək, dikəltmək, biz-biz etmək, dik vəziyyətə salmaq. *Xoruz tüklərini qabartdı. – At yalını qabartmış, quyruğunu dikəltmiş, gözlərini və qulaqlarını oynadır, .. kişnəyirdi.* S.Rəhimov.

4. Suluqlandırmaq, qabar etmək. *Gicitkən əlimi qabartdı.*

**QABARTMALI** *sif.* Qabartmaları, qabartmalar şəklində bəzəyi olan. *Yan divarlardan birisində .. güzgülər vurulmuşdu; o birisində zərif naxışlı əlvan qabartmalı taxçalar vardı.* Çəmənzəminli.

**QABAYUNLU** *sif.* Yunu qaba olan, yunu zərif olmayan. *Qabayunlu qoyun.*

**QABIQ** *is.* 1. Bir şeyin üstünü örtən sərt örtü. *Ağacın qabığı. Yumurtanın qabığı. Qoz qabığı. – Mağaranın içi yumşaq ağac qabıqları ilə döşənmişdi.* A.Şaiq. ☐ **Qabıq bağlamaq** – üstündə qabıq əmələ gəlmək, qabıqlanmaq.

2. *zool.* Bəzi onurğasız heyvanlarda: buynuz təbəqəsindən ibarət olan üst örtü, qın. *Xərçəng qabığı.*

3. Dəri, insan və heyvan dərisi. *Qabığı soyulmaq.* ☐ **Qabıq vermək** – qabığı, dərisi soyulmaq. *Günün altında çox yanmışam, bədənim qabıq verir.*

◊ **Qabıq qoymaq** – çox zəhmət çəkmək, çalışmaq, çalışıb əldən düşmək. [Mirzə Mustafa bəyə:] *Siz qabıq qoymamışsınız. O qabığı bu fağır camaat qoyub.* Ə.Haqverdiyev. **Qabıqdan çıxmaq** – 1) çox çalışmaq, çox əlləşmək, bütün gücünü sərf etmək. *Qüdrətin tresti çox geridə qalıb, azı yarım il gərək qabıqdan çıxsın ki, bəlkə bizə çatdıra.* M.Hüseyn. *O, qabıqdan çıxıbdır hər biriyçün min kərə.* B.Vahabzadə; 2) var-yoxdan çıxmaq, soyulmaq. **Qabığına yerləşməmək (sığmamaq)** – 1) həddindən artıq sevinmək; 2) son dərəcə təşəxxüslənmək, qürrələnmək, lovğalanmaq.

**QABIQLANMA** "Qabıqlanmaq"dan *f.is.*

**QABIQLANMAQ** *f.* 1. Qabıq bağlamaq, qabıq tutmaq. *Fındıq hələ qabıqlanmayıb.*

2. Qat-qat soyulmaq, qat-qat qopmaq.

3. *məc.* Köz bağlamaq, köz tutmaq, üstü örtülmək (yara haqqında).

**QABIQLI** *sif.* Qabıqla örtülü olan, qabığı olan (meyvə və s.). // Qılaflı. *Qabıqlı böcək.*

**QABIQOTU** *is. bot.* Əkin yerlərində və yamaclarda bitən alaq otu.

**QABIQSIZ** *sif.* Qabığı olmayan (meyvə və s.); üstündə qabığı olmayan, qabıqla örtülü olmayan; qılafsız. *Qabıqsız və sümüksüz böcəklər* (*yumşaqbədənlilər*).

**QABIQYEYƏN** *is. zool.* Bitkilərin qabığını yeyən ziyanverici (böcək).

**QABIRĞA** *is. anat.* 1. Fəqərələri döş sümüyü ilə birləşdirən qövsşəkilli sümük. *İnsanın yeddi cüt yuxarı və beş cüt aşağı qabırğası vardır. – Qabırğalar yastı və mötərizə şəklində olub, fəqərələrin yanlarından qabağa doğru uzanmışlar və döş qəfəsinin yan divarlarını təşkil edirlər.* Balakişiyev.

2. Bədəndə qabırğaların yerləşdiyi yer; böyür. *Yan qabırğası əzilmək. – Qarovula tapşırmışam ki, içəri girmək istəyən kimi, bir güllə vur qabırğasına!* M.S.Ordubadi. *İskəndər kişi qabırğasına dəyən zərbələrin şaq-*

*qıltısı arasından Bahadırın çığırtısını da eşitmişdi.* M.Hüseyn.

3. Bir şeyin kənarı, yanı, bir tərəfi. *Samovarın qabırğası batmışdır.*

◊ **Qabırğa vermək** – 1) əyilmək, yıxılmağa meyil etmək. *Bu divar, deyəsən, ortadan qabırğa verir;* 2) qulaqardına vurmaq, özünü bilməməzliyə qoymaq, özünü arsızlığa vurmaq. **Qabırğa kimi əyri** – islahı çətin olan tərs adam haqqında.

**QABIRĞAALTI** *sif. anat.* Qabırğaların altında olan. *Qabırğaaltı ət.*

**QABIRĞAARASI** *sif. anat.* Qabırğaların arasında olan. *Qabırğaarası əzələ.*

**QABIRĞACIQ** *is.* Kiçik qabırğa.

**QABIRĞALI** *sif.* 1. Qabırğası olan.

2. Qabırğa kimi çıxıqları, yanları olan (qab və s.).

3. *məc.* Kök, ətli-canlı, yekə, dolğun, sağlam.

**QABIRĞASÖHBƏTİ** *is. dan.* Uzanmış halda edilən söhbət. *Gecə hava durğun və isti olduğundan, yataqlarını eyvanda yan-yana döşəyərək, bir neçə saat qabırğasöhbəti etdilər.* A.Şaiq. [Rüstəm] *çay-çörəkdən sonra onunla qabırğasöhbəti də elədi*. S.Rəhimov.

**QABİL** *sif.* [*ər.*] 1. İstedadlı, qabiliyyətli, hər şeyi tez qavrayan zehinli, zəkalı. *Qabil uşaq. Qabil tələbə. – Qabil şagird ustad olur ustadan*. (Ata. sözü). *Adam var ki, yüz sözdən bir məna duymağa qabil deyildir.* Ə.Abasov. // Bacarıqlı, hər şeyi bacaran, mahir, məharətli, ustad. *Qabil usta. Qabil sənətkar. Qabil dərzi. – Maşallah, nə yaxşı qabilsən; Bağçabanlıqda xeyli kamilsən*. A.Səhhət. [Ahıl qadın dedi:] *İndi biz gəlib Cahan xalaya tay ola bilmərik. Özü də bir qabil arvaddır.* Ə.Haqverdiyev.

2. Mümkün olan. *Əlacı qabil deyil. Düzəlməsi qabil deyil. – Tətbiqi qabil isə, fikrin gözəldir*. Çəmənzəminli.

3. Yararlı, münbit, yaxşı. *Mən səpdiyim toxum qabil torpağa səpilib*. Ə.Haqverdiyev.

**QABİLİYYƏT** *is.* [*ər.*] 1. İstedad, fitri zəka; bir şeyi tez qavrama, tez mənimsəmə bacarığı. *Musiqiyə qabiliyyət. Onun riyaziyyat elmlərinə qabiliyyəti böyükdür. Bu tələbənin dillərə qabiliyyəti yoxdur. – İnsanda qabiliyyət də gərək olsun, zəkavət də gərək olsun, hamı oxuyan alim olmaz.* C.Məmmədquluzadə.

2. Bir şeyi etmək imkanı, bacarığı. *Yerimək qabiliyyətini itirmək. Əhalinin alıcılıq qabiliyyəti qat-qat artmışdır. Orqanizm müxtəlif xarici təsirlərə müqavimət göstərmək qabiliyyətinə malikdir.*

3. Ləyaqət, mərifət, kamal. *Qabiliyyətdə, mərifətdə, kamalda; Bu cahanda sənin kimi qız olmaz*. Aşıq Ələsgər.

**QABİLİYYƏTLİ** *sif.* 1. Qabiliyyətli, istedadlı, bacarıqlı, zehinli. *Qabiliyyətli uşaq. Qabiliyyətli tələbə. Qabiliyyətli usta. Qabiliyyətli adam.*

2. Ləyaqətli, dəyərli, layiq, münasib. *Qabiliyyətli bir hədiyyə.*

**QABİLİYYƏTSİZ** *sif.* Qabiliyyəti, istedadı, bacarığı olmayan; istedadsız, bacarıqsız. *Qabiliyyətsiz adam.* – [Kor kişi] .. *günəşin işığına baxa bilməzdi. Zəhmətə qabiliyyətsiz idi.* S.Hüseyn. // Ləyaqəti olmayan, ləyaqətsiz; mərifətsiz. *Qabiliyyətsiz, mərifətsiz qızların; Yüzü bir dərdmənd dul ola bilməz*. Aşıq Ələsgər. *Əsrimizdə bu cür adamlar çoxdur, onlar xain, dəyərsiz, qabiliyyətsiz olduqları üçün yüksəlməyi ancaq alçaqlıqda axtarırlar.* M.S.Ordubadi.

**QABİLİYYƏTSİZLİK** *is.* Qabiliyyəti, istedadı, bacarığı olmama; istedadsızlıq, bacarıqsızlıq. *Bu işdə onun qabiliyyətsizliyi meydana çıxdı.* // Ləyaqətsizlik, mərifətsizlik.

**QABİLLƏŞMƏ** "Qabilləşmək"dən *f.is.*

**QABİLLƏŞMƏK** *f.* Daha da qabil olmaq, qabiliyyəti, istedadı, bacarığı artmaq. // Məharətli olmaq, ustalaşmaq, kamilləşmək.

**QABİLLİK** *is.* Qabil olma; istedadlılıq, bacarıqlılıq, mahirlik. [Növrəstə:] *Yox, qabillikdə iş yoxdur. Mollaxanada köhnə qayda ilə, köhnə əlifba ilə dərs verirdilər, odur ki, orada boş yerə neçə il sərf eləyib, bir şey də öyrənə bilmirdilər.* Ə.Haqverdiyev.

**QAB-QACAQ** *top.* İçərisində xörək hazırlamaq, yaxud içərisinə yemək şeyləri qoymaq üçün qablar. *Qab-qacaq mağazası. Qab-qacaq yumaq. Qab-qacaq şkafı. – Bu məfrəşlərdə bir qədər qab-qacaq və qeyri ev şeyləri vardır*. S.S.Axundov. *Küçələrə tökülmüş sınıq qab-qacaqları görürkən, .. yolçunun ürəyi sıxıldı*. Ə.Məmmədxanlı.

◊ **Qabına-qacağına sığmamaq** – bax **qabına sığmamaq** (“**qab**”da). [Telli] *sevincindən qabına-qacağına sığmırdı.* S.Hüseyn.

**QAB-QAŞIQ** *top*. Süfrəyə lazım olan qab, qaşıq və s. komplekti. *Belə tutaq ki, sən evində bir pişik saxlayırsan və bu pişik yaxşı dolanmır; məsələn, qab-qaşığı gəlib yalayır.* C.Məmmədquluzadə.

**QAB-QAZAN** *top*. İçərisində xörək bişirilən və ya içinə xörək qoyulan mətbəx ləvazimatı. [Xortdan:] *Görürsən neçəsi .. qab-qazanın arasında, taxçalarda qıvrılmış yatıbdır*. Ə.Haqverdiyev. [Arvad:] *İndi mən qaragün məfrəşləri bağlayım, qab-qazanı bağlayım, toyuq-cücəni tutum, ya sizə xörək hazırlayım?* H.Sarabski.

**QABQIRAN** *is. dan.* Yarpağının içində süd kimi ağ maye olan bir bitki; qabsındıran, kasasındıran.

**QABLAMA**[1] “Qablamaq”dan *f.is.*

**QABLAMA**[2] *is.* Qulpsuz və ya qulplu qapağı olan kiçik qazança. □ **Qablama qazan** – kip qapağı olan qazança. [Qoçu Heybətin] *çox gülünc görünüşü vardı. Başında qablama qazana oxşar Buxara dərisindən qara papaq var idi.* H.Sarabski.

**QABLAMAQ** *f.* 1. Qoymaq, kip qoymaq. *Qazanın qapağını qablamaq*.

2. Yerbəyer etmək, yerləşdirmək; qayda ilə bir şeyin içinə qoymaq, yığmaq. *Paltarları çamadana qablamaq. – Ustalar dizlərini yerə qoyub, üzümü yeşiyə qablayırdılar.* Mir Cəlal.

**QABLANMA** “Qablanmaq”dan *f.is.*

**QABLANMAQ** *məch.* 1. Qoyulmaq, kip yerləşdirilmək. *Paltarlar çamadanlara qablanmışdır*.

2. Kobudcasına bir şey üzərinə üzüqoylu düşmək, sərilmək. *Hovuza qablanıb su içdi*.

**QABLAŞDIRILMA** “Qablaşdırılmaq”dan *f.is.*

**QABLAŞDIRILMAQ** *məch.* Yerbəyer edilmək, qayda ilə yerləşdirilmək, bir şeyin içinə qoyulmaq.

**QABLAŞDIRMA** “Qablaşdırmaq”dan *f.is.*

**QABLAŞDIRMAQ** *f.* bax **qablamaq** 2-ci mənada. *Novruzqulu evə qayıdıb arvada deyərdi ki, tez ol, tədarük gör, avadanlığı qablaşdır, arabalar indi gələr..* H.Sarabski.

**QABLAŞMA** “Qablaşmaq”dan *f.is.*

**QABLAŞMAQ** *f.* Qaba yerləşmək, yerbəyer olmaq.

**QABLATDIRMA** “Qablatdırmaq”dan *f.is.*

**QABLATDIRMAQ** *icb.* Üçüncü şəxs vasitəsilə qablatmaq.

**QABLATMA** “Qablatmaq”dan *f.is.*

**QABLATMAQ** *icb.* Qablama işi gördürmək.

**QABSINDIRAN** bax **qabqıran**.

**QAC**[1] *is. dan.* Düşmən, zidd, əks, müxalif. *Dost dost ilə qac olmaz; Bir tikəylə ac olmaz.* Aşıq Ələsgər. □ **Qac düşmək (olmaq)** – düşmən olmaq, zidd olmaq, çəkişmək. *Qafur təslim olmayır, döyüşür dalğalarla; Həyatında ilk dəfə qac düşür dalğalarla.* S.Rüstəm.

**QAC**[2] *is. məh*. Yer sulamaq üçün ayrılan kiçik arx. *Gəl yoldaş, çalışaq, eyləyək birlik; Arada xəndək, qac daha olmasın.* Miskin Əli.

**QACA** *sif.* Çox işlənmək nəticəsində çala-çuxur bir hala düşmüş. *Qaca yol.*

**QACIMA** “Qacımaq”dan *f.is.*

**QACIMAQ** *f.* Quruyaraq yığışmaq, bürüşmək (yaş ağac və s.).

**QACINMA** “Qacınmaq”dan *f.is.*

**QACINMAQ** *f.* Qollarını geriyə qanıraraq, döşü qabağa verib dərin nəfəs almaq; gərnəşmək.

**QACLAŞMAQ** *f. dan.* Zidd olmaq, düşmən olmaq.

**QACLIQ** *is. dan*. Zidlik, düşmənlik.

**QAÇAĞAN** *sif.* 1. Çox bərk qaçan, itigedən, yerişi sürətli olan (at və s.). *Məstan bir qaçağan ahuya dönüb, indi kəməndə gəlmir*. S.Rəhimov.

2. *məc.* İşlədiyi yeri tez-tez dəyişən (adam).

3. Adamdan hürkən, adamayovuşmaz.

**QAÇAĞANLIQ** *is.* 1. Qaçmaq xasiyyəti. *Dovşan qorxaqlıq, qaçağanlıq əlamətidir*. Ə.Vəliyev.

2. Ürkəklik, adamayovuşmazlıq.

**QAÇAQ** *is.* 1. Çarlıq dövründə: hökumətin zülm və ədalətsizliyinə dözməyərək, həbsdən və ya sürgündən qaçan adam.

2. Bir cinayət edib hökumətdən və ya həbsdən qaçaraq, dağda və meşələrdə yaşayıb soyğunçuluqla məşğul olan adam; quldur. *Ancaq bu həndəvərdə məşhur bir qaçaq var*. M.F.Axundzadə. [Novruz:] *Ağa, nə üçün fikir edirsən, yoxsa qaçaqlardan qorxursan?*

N.Nərimanov. [Gülpəri:] ..*Hər şey əldən çıxandan sonra, Əmiraslan məni qovub, özü də qaçaq dəstəsinə qoşuldu.* S.S.Axundov.

3. Bu və ya başqa bir səbəbə görə qaçmağa, baş götürüb getməyə məcbur olan adam. ☐ **Qaçaq düşmək** – müxtəlif səbəblərə görə öz yurdundan, ailəsindən uzaq düşməyə məcbur olmaq. *Hacı da ondan sonra düşdü qaçaq; Qaldı dağlarda el, ulusdan iraq.* A.Səhhət.

4. *sif.* Sürüdən qaçan, sürüdə durmayan. *Qaçaq qoyun.* // Bərk gedən, başını saxlamaq çətin olan. *Qaçaq at.*

5. *sif.* Gömrük, rüsum verməmək üçün gizli gətirilən. *Qaçaq mal. Qaçaq tütün.* – [Əsgər bəy:] *On beş günədək Təbrizə gedərik, qayıdarıq, qaçaq mal gətirrik, birə-bir qazanarıq.* M.F.Axundzadə. [Əhməd] ..*qaçaq mal alveri eləməkdən başqa yüngül və əziyyətsiz bir yol tapa bilməyirdi.* B.Talıblı.

**QAÇAQAÇ** *sif.* Bir təhlükə üzündən, yaxud başqa bir səbəbə görə qorxuya düşüb, kütləvi surətdə qaçma. *Birdən qaçaqaç düşdü; dedilər naçalnik gəldi.* C.Məmmədquluzadə. *İki dəstə bir-birinə harada rast gəlsəydi, partapart başlanar, qaçaqaç düşər, camaat bir-birinə qarışardı.* H.Sarabski.

**QAÇAQÇI** *is. köhn.* Qaçaq mal gətirməklə məşğul olan adam. [Hacı Qara:] *Hamısına tövbələtmə verrəm ki, dəxi heç qaçaqçının qabağını kəsməsinlər!* M.F.Axundzadə. *Bu qaçaqçı seyidlər içərisində ən məşhuru və ələkeçməzi Mir Cümə adlı birisi idi.* P.Makulu.

**QAÇAQÇILIQ** *is.* Qaçaq mal gətirməklə məşğul olma; qaçaqçının işi, peşəsi. ☐ **Qaçaqçılıq etmək** – 1) qaçaq mal gətirməklə məşğul olmaq; 2) quldurluq etmək.

**QAÇAQ-QULDUR** *is.* Yolkəsən, qaçaq, quldur. *Karvan gedir, yolda qaçaq-quldur qabağını kəsir..* Çəmənzəminli.

**QAÇAQLIQ** *is.* 1. Quldurluq. [Bahadır:] *Görünür, çoxusu aclıqdan qaçaqlıq edir.* N.Nərimanov. [Hacı Murad:] *Sənin yediyin .. oğurluqla, qaçaqlıqla, yetimin malını mənimsəməklə yığılıbdır..* S.S.Axundov. [Sonqulu] *bir neçə il qaçaqlıq edib, heç kəslə işi olmur, ancaq dövlətlilərə düşmən kəsilir.* H.Sarabski.

2. Qaçaq; qaçqın adamın halı. *Qaçaqlıq həyatı.*

**QAÇAQMALÇI** b a x **qaçaqçı**. *Bir gün* [Əhməd] *qaçaqmalçı Məşədi Cavadın qızını istədi, fəqət rədd cavabını aldı.* B.Talıblı.

**QAÇÁN** *f.sif.* b a x **qaçağan** 1-ci mənada.

**QÁÇAN** "Haçan" sözünün qədimi forması.

**QAÇARAQ** *zərf* Qaça-qaça, yüyürə-yüyürə; tez-tez, tez. *Qaçaraq gəlmək.* – [Xədicə] *bərabərimə yetişincə çəpərin arxasından iki əlləri ilə boynumu qucaqlayıb qaçaraq gözdən qeyb oldu.* S.Hüseyn.

◊ **Qaçarağa salmaq** – qaçırtmaq, qaçmağa məcbur etmək.

**QAÇARAQLAMA** "Qaçaraqlamaq"dan *f.is.*

**QAÇARAQLAMAQ** *f.* Çox tez qaçmaq, yüyürmək, götürülmək, qaçaraq getmək, ya gəlmək. *Bir qədərdən Məcid qaçaraqlayıb bir bağlama gətirdi.* S.Rəhimov.

**QAÇATBASDI** *zərf dan.* Çox tələsik, səbirsizliklə.

**QAÇDI-TUTDU** *is.* Uşaq oyunlarından birinin adı. [Sevinc:] *Bu nədir Qaçay? Elə bil qaçdı-tutdu oynayırsınız.* Z.Xəlil.

**QAÇILMAZ** *sif.* Qaçılması mümkün olmayan; labüd. *Qaçılmaz bəla* – [Solmaz:] *Artıq bu yaman odlardan və ölümün qaçılmaz varlığından başqa heç bir şey düşünmürəm.* C.Cabbarlı.

**QAÇILMAZLIQ** *is.* Qaçılması mümkün olmama; labüdlük.

**QAÇINMA** "Qaçınmaq"dan *f.is.*

**QAÇINMAQ** *f.* Saqınmaq, çəkinmək, qaçmaq (4-cü mənada); uzaqlaşmaq, bir şeydən, ya bir işdən özünü kənara çəkmək.

**QAÇIR(D)ILMA** "Qaçır(d)ılmaq"dan *f.is.*

**QAÇIR(D)ILMAQ** "Qaçırmaq"dan *məch.* *İstəkli vətən gülləri! Sizsiz yaz açılmaz; Gün çıxmasa, zülməti-şəbistan qaçırılmaz.* Ə.Nəzmi.

**QAÇIRMA** "Qaçırmaq"dan *f.is.*

**QAÇIRMAQ** *f.* 1. Birinin qaçmasına kömək etmək, yol vermək, səbəb olmaq; birini aradan çıxarmaq.

2. Qaçmağa məcbur etmək. *Düşməni qaçırmaq.* // Hürkütmək. *Quşları qaçırmaq.*

3. Hüduddan gizli mal keçirmək (daxil etmək və ya çıxarmaq).

4. Oğurlamaq, xəlvəti aparmaq. *Oğrular gecə qonşunun atını qaçırdılar. Qız qaçırmaq.*

5. Bir sıra isimlərin yanına gətirilərək mürəkkəb feil düzəldilir; məs.: əldən qaçırmaq, nəzərdən qaçırmaq, ağızdan qaçırmaq.

**QAÇIRTMA** "Qaçırtmaq"dan *f.is.*

**QAÇIRTMAQ** *icb.* 1. Başqası vasitəsi ilə qaçmağa vadar etmək və ya qaçmaqda başqasına kömək etmək.

2. B a x **qaçırmaq**.

3. Göndərmək, tez getməsini əmr etmək. *Xan artırmaya adam qaçırtdı, heç kəs bu əhvalatdan baş aça bilmədi.* Çəmənzəminli.

**QAÇIŞ** *is.* Qaçma, qaçmaq işi və tərzi. // *idm.* Qaçma yarışı. *Qaçış texnikasını təkmilləşdirmək.*

**QAÇIŞMA** 1. "Qaçışmaq"dan *f.is.*

2. *is.* Qaçma yarışı.

**QAÇIŞMAQ** *qarş.* 1. Kütləvi halda hərə bir tərəfə qaçmaq, tez hərə bir tərəfə dağılmaq, o tərəf-bu tərəfə qaçmaq. *Parapet ətrafında və Olginski küçədə olan camaat qaçışırdı.* M.S.Ordubadi. *Qarışdı məclis bütün; Qaçışdı rəqqasələr.* Ə.Cavad. *Yüzlərcə uşaqlar meydançada qaçışıb-oynaşır.* Mir Cəlal.

2. Qaçışda yarışmaq. *İdmançılar sürətlə qaçışırdılar.*

**QAÇQIN** *is.* Müharibə, təbii fəlakət və başqa səbəblər üzündən yaşadığı yeri tərk etmiş, oradan qaçmış adam. *Ağa Məhəmməd şahın basqınından qaçan qaçqınlar yollarda ağır vəziyyətə rast gəldilər.* Mirzə Adıgözəl bəy. *Şəhidlərin, qaçqınların; Üstümüzdə min ahı var; Çatdığımız bu nöqtədə; Hamımızın günahı var.* B.Vahabzadə. // Mühacir.

**QAÇQINLIQ** *is.* Müharibə, təbii fəlakət və s. üzündən əhalinin öz yerlərini kütləvi surətdə tərk etməsi, öz yerlərindən qaçması. *Ballının yerli-yataqlı danışığı, .. qaçqınlıq illərini kədərli söyləməsi Budağı uzun müddət dərin fikirlərə qərq edirdi.* Ə.Vəliyev. // Mühacirət.

**QAÇ-QOV** b a x **qaçaqaç**.

**QAÇMA** "Qaçmaq"dan *f.is.*

**QAÇMAQ** *f.* 1. İti, cəld addımlarla getmək, çox iti getmək; yüyürmək. *Hara belə qaçırsan? – Pərinisə hövlnak qaçdı ərinin yanına və bilmədi nə eləsin.* C.Məmmədquluzadə. *O, tələsik yerindən durub qapıya qaçdı.* M.İbrahimov.

2. İş yerindən, həbsdən və s.-dən özbaşına getmək, xəlvəti getmək. *..İki nəfər dərsdən qaçıb, oturmuş imişlər çayın kənarında.* C.Məmmədquluzadə. [İsmayıl:] *Ay qardaş, Sibirdən qaçmaq ki qeyri-mümkündür.* Ə.Haqverdiyev. // Salındığı, yaxud saxlandığı yerdən çıxıb getmək, uzaqlaşmaq. *İnək tövlədən qaçmışdır.*

3. İcazəsiz olaraq qoşulub getmək, evini, ailəsini tərk edib getmək. *Qız bir oğlanla qaçdı.*

4. Çəkinmək, saqınmaq, uzaqlaşmaq, əlaqə saxlamamaq, gözə görünməməyə çalışmaq. *Pis yoldaşdan qaç. Tanışlardan niyə qaçırsan?*

5. Boyun qaçırmaq, imtina etmək, yaxa qurtarmağa çalışmaq. *O, aydın suala cavab verməkdən qaçır. Məsuliyyətdən qaçmaq.*

6. Getmək, yox olmaq, çəkinmək. *Rəngi qaçmaq. Yuxusu qaçmaq. Ləzzəti qaçmaq. – Saatlarca davam edən qarışıq fikirlər İbrahim xanı məşğul etdi, əsəbiləşdi, yuxusu tamamilə qaçdı.* Çəmənzəminli.

**qaça-qaça** *zərf* Qaçaraq, yüyürə-yüyürə, yüyürərək. *Qaça-qaça gəlmək.* – [Əşrəf:] *Salatının qaça-qaça onlara yaxınlaşdığını görüb susdu.* İ.Şıxlı.

**QADA** *is.* 1. Bəla, dərd, müsibət, fəlakət. *Koroğlu əyilməz yağıya, yada; Mərdin əskik olmaz başından qada.* "Koroğlu". *Bənd oldu könül bir gülə, səs tutdu mahalı; Guya ki, bu dünyada qan oldu, qada düşdü.* C.Cabbarlı.

2. "**Qadası**" şəklində – yalvarış, yaxud nəvazişli xahiş – xitab bildirir. *Qadası, de görüm, axı bu nə əhvalatdır?* M.S.Ordubadi. [Mahmud arvadına:] *Bu kələyə razısanmı? ..İndi gəl üzündən öpüm, qadası!..* B.Talıblı.

◊ **Qadan(ı) alım!** – yalvarışlı, yaxud nəvazişli xahiş bildirir. [Şahbaz bəy:] *Şərəfnisə, qadan alım, bilirsən ki, əmidostum bu gün nə tufan elədi?* M.F.Axundzadə. *Qadan allam, ey qara göz, sənə bu əda neçindir?* S.Ə.Şirvani. *Motalpapaq, kürklü bir kişi komandana yaxınlaşaraq dedi: – Qadan alım, komandir, biz ağsaqqallar təvəqqe edirik ki, bizdən də bir neçəmizi özünüz ilə aparasınız.* H.Nəzərli. **Qadam sənə (olsun)!** – qarğış ifadəsi. **Qadası canıma** – əzizləmə, pərəstiş ifadəsi. *Başını buladı, gözündən güldü; Güləndə qadası canıma düşdü.* Aşıq Ələsgər.

**QADA-BALA** b a x **qada**. *Qab sınması el arasında qada-balanın izalə olması mənasında təfsir olunur.* Çəmənzəminli.

**QADAĞA** *dan.* b a x **qadağan**. *Qorxmursan ovçudan, tülək tərlandan; Məgər yoxdur*

*sənə qadağa, kəklik!* Aşıq Rəcəb. *Sevmə, sevilmək deyil əsrimizdə qadağa*. M.Rahim.

**QADAĞAN** *is.* 1. İcazə verilməyən, müsaidə edilməyən şey; adətən xəbər kimi işlənir: **qadağandır** – qanunən icazə verilmir, yasaqdır. *Kənar adamların daxil olması qadağandır. Zalda papiros çəkmək qadağandır. – Bir kimsə soruşmur, bu nə fəryadü fəğandır? Ceyranı atıb vurma, yasaqdır, qadağandır!* Ə.Vahid.

2. Adətən köməkçi feillərlə: **qadağan etmək** – edilməsinə icazə verməmək, qəti surətdə yol verməmək, yasaq etmək. *Gülsüm on yaşına çatandan sonra atası ona Şaban ilə görüşməyi qadağan etdi*. Ə.Haqverdiyev. ☐ **Qadağan edilmək (olunmaq)** – qanunən icazə verilməmək, yol verilməmək, yasaq edilmək. *Xiyabani, doktor Ərani və başqa bu kimi mütərəqqi xadimlərin yazıları qadağan olunmuş əsərlər cərgəsində idi*. M.İbrahimov.

**QADAQ** *is.* Bıçaq, qayçı, kəlbətin kimi alətlərin tiyəsini canına bərkidən bənd, ox. *Bıçağın qadağı laxlayır*.

◊ **Qadaqda saxlamaq** – sərbəstlik verməmək, müəyyən həddən kənara çıxmağa qoymamaq. *Bu dil ki var, onu bağlamasan, başa bəladır. Gərək onu həmişə qadaqda saxlayasan.* S.Rəhimov.

**QADALI** *sif.* Bəlalı, dərdli, başıbəlalı, müsibətli. [Qazan xan:] *A üzü qaralı, başı qadalı, xatınları, oğul-uşağı nə deyə dustaq etdin?!* M.Rzaquluzadə.

**QADIN** *is.* Cins etibarı ilə kişinin əksi; arvad. *Qadınlar bayramı. Evdar qadın. Qadın həkim. – Ayrım qızı şişman bir qadın idi. Kiçik qumral gözləri, ay kimi yuvarlaq üzü var idi.* A.Şaiq. *Bir qadın gözündə qəm duysam, o dəm; Sanıram ömrümün qürub çağıdır.* M.Araz.

**QADINLIQ** *is.* 1. Qadına xas olan sifətlər, xüsusiyyətlər. *..Səninsə qadınlıq haqqındır bəlkə; Məni qısqanırsan çiçəklərə də.* M.Araz.

2. *top*. Qadınlar. *Mədəni qadınlığın tarixi bizim qarşımızda oturan bu gənclərlə başlanır*. M.S.Ordubadi. [Növrəstə:] *İndiyədək iş başında qolçomaqlar durdurdular, onlar hamısı qadınların və qadınlığın düşməni idilər.* Ə.Haqverdiyev.

**QADİR** *sif.* [*ər.*] 1. Qüdrətli, böyük qüvvət və qüdrət sahibi olan. *Qadir xalqımız öz gələcəyinə inamla baxır.* // Bacaran, qabil; qüvvəsi, gücü çatan. *Hər ikisi şiddətli naxoş olduqlarından hərəkətə qadir deyildilər.* M.S.Ordubadi. ☐ **Qadir olmaq** – bacarmaq, bir şeyi etməyə qüvvəsi və qüdrəti olmaq. – [Ağa Mərdan:] *Bir az ürəkli olsun, yoxsa mürafiə vaxtında qorxuram iqrara qadir olmuya.* M.F.Axundzadə. *Yavaş-yavaş ətrafımdakı şeyləri seçməyə qadir oldum.* S.S.Axundov.

2. *din.* Yaradan, Allah mənasında. ☐ **Qadiri-mütləq** – Allah. *Axı Kərəmov özünü qadiri-mütləq bilirdi..* İ.Əfəndiyev.

**QADİRLİK** *is.* Bacarma, böyük qüvvət və qüdrət sahibi olma; qüdrət, bacarıq.

**QAF**[1] [*ər.*] Ərəb əlifbasında ( ق ) şəklində yazılan hərfin adı.

**QAF**[2] *is.* [*ər.*] *klas.* Əfsanələrdə: ənqa (Simurq) adlı mövhumi quşun yaşadığı Qafqaz sıra dağlarından birinin – Elbrusun (Əlbürzün) qədim adı. *Hər quşun olmaz səadətli hümatək kölgəsi; Çünki simurqəm, deyirsən, laməkan Qafın qanı?* Nəsimi. *Ünqa kimi Qaf olub məkanın; Ləb açmıya bülbüli-pəyamın.* Məsihi.

**QAFA** *is.* [*ər.*] Baş. *Çar zabitlərinin qafasında iki şey hökm sürürdü: şəhvət və şərab.* M.S.Ordubadi. *Həkimin olmasa qırxıq qafası; Mərizə faidə verməz dəvası.* M.Möcüz. ☐ **Qafa tası** – baş kasası, kəllə. *Üzünüzü Reyxstağın qəbirdən çıxmış bir qafa tası kimi eybəcər xarabasına tutun!* R.Rza.

**QAFALI** bax **başlı** 1-ci mənada. *Hanı məclisi-qumarın, rüfəqayi-meykusarın? Hanı nəşəyi-xumarın, a qalın qafalı fələ?!* M.Ə.Sabir.

**QAFASIZ** b a x **başsız** 1-ci mənada.

**QAFİL** *sif.* [*ər.*] 1. Nə edəcəyini və başına nə gələcəyini irəlicədən düşünməyib, işini boş tutan; qəflətdə olan; ehtiyatsız, diqqətsiz, xəbərsiz. *Qafil xortdan, bu nə xabi-qəflətdir ki, uyubsan!* Ə.Haqverdiyev. *Bu qafil qıza mənim yazığım gəlirdi.* M.S.Ordubadi. // İs. mənasında. *Üzünü güzgüyə qeybətdə oxşadan qafil; Toxunsa üz-üzə, olmazmı ara yerdə xəcil?* Füzuli. *Ey qafil, özündən sənin ancaq xəbərin var!* M.Ə.Sabir. ☐ **Qafil olmaq** – qəflət etmək: ehtiyatsız (diqqətsiz, xəbərsiz) olmaq, fürsəti əldən çıxarmaq, ehtimal etmək. *Olma qafil, ər kimi tərpən, işin*

*mərdanə tut.* Füzuli. *Vermişəm sən təki bimehrə könül qafil olub; Olmuşam indi yaman yerdə peşiman, əfsus!* S.Ə.Şirvani. *Dəxi nə deyirsən, sözün nədir, niyə qafil olursan?* C.Məmmədquluzadə.

2. Ansızın, gözlənilməz, nagahani, qəfil. *Məni hicriylə bir halə salıb gülüzlü ol dilbər; Ki, yüz yol istərəm çatsın əcəl, qafil ölüm hər an.* Heyran xanım.

**QAFİLANƏ** *zərf* [*ər.* qafil və *fars.* ...anə] Qafilcəsinə, qəflətdə olaraq; diqqətsizliklə, xəbərsizcəsinə, ehtiyatsızcasına. *Qafilanə hərəkət etmək. – Xab et, hələ qafilanə xab et.* M.Ə.Sabir. *Azacıq tar olursa indi hava; Sevinir hər tərəfdə şəbpərələr; Aldanıb qafilanə rəqs eylər.* H.Cavid.

**QAFİLƏ** *is.* [*ər.*] Birlikdə yol gedən atlılar və s. dəstəsi; karvan. *Qafilə bir az irəliləyib sağ tərəfə – qala qapısına doğru döndü.* Çəmənzəminli. *Fəxrəddinin qafiləsi Araz çayından Şimali Azərbaycana keçdiyi zaman onun atının ayaqları altında yüzlərcə qurban kəsildi.* M.S.Ordubadi. *Qadın və uşaqdan ibarət olan bu qafilə içərisində yalnız beş kişi var idi.* A.Şaiq. // Bir-birinin ardınca gedən maşın və s. dəstəsi; qatar.

**QAFİLLİK** *is.* Qəflət etmə, qəflətdə olma, qafil olma; xəbərsizlik, işin qabağını, dalını düşünməmə, fürsəti əldən vermə. *Anası diqqətlə Ulduzun gözlərinə baxdı və Nərgiz xanım yalnız indi öz qafilliyinə heyrət etdi.* Ə.Məmmədxanlı.

**QAFİYƏ** *is.* [*ər.*] *ədəb.* Şeirdə: beytlərin və ya misraların son söz və ya səslərinin uyğunluğu, həmahəngliyi. *Bu şerin qafiyələri düz gəlmir. – Demirəm mən sənə şair deyilsən, var şerin; Vəzni var, qafiyə var, qaliba yox can, Yusif!* S.Ə.Şirvani.

**QAFİYƏBAZ** *is.* [*ər.* qafiyə və *fars.* ...baz] Şerin məzmununa fikir verməyib, ancaq qafiyələri güdən, qafiyələrin düz gəlməsinə çox fikir verən şair.

**QAFİYƏBAZLIQ** *is.* Yalnız qafiyə güdüb, şerin mənasına fikir verməmə.

**QAFİYƏLİ** *sif.* Qafiyəsi olan. *Qafiyəli beyt. Qafiyəli şeir. – Ünvanına tək-tək qafiyəli hərzə də yağdırdılar.* R.Rza.

**QAFİYƏPƏRDAZ** *sif.* və *is.* [*ər.* qafiyə və *fars.* pərdaz] Qafiyə düzəldən, qafiyə uyduran (şair). *Şövqü-vəsli-çəmənində sənin, ey mayeyi-naz; Təbimin bülbülüdür qafiyəpərdaz bu gecə.* Şəhriyar.

**QAFİYƏPƏRDAZLIQ** *is.* Qafiyə düzəltmə, qafiyə uydurma. *Nəhayət, Sabiri "Sabir" edən "Molla Nəsrəddin" oldu. Təb Sabirin idi, qafiyəpərdazlıq Sabirin idi, istedadı-şeriyyə Sabirin idi, fəqət mövzu verən "Molla Nəsrəddin" və Mirzə Cəlil idi.* Ə.Haqverdiyev.

**QAFİYƏSİZ** *sif.* Qafiyəsi olmayan, qafiyəsi pozğun olan. *Nə qədər çalışdın "ağ" alınmadı; Köhnə qafiyəsiz darıxdı şerim...* M.Araz.

**QAFİYƏSİZLİK** *is.* Qafiyə nöqsanı, qafiyədə uyğunsuzluq; ahəngsizlik, pozğunluq. // Şeirdə sərbəstlik, qafiyə olmama.

**QAFQAZLI** *sif.* və *is.* Qafqaz xalqlarından birinə mənsub olan; Qafqaz əhli. *Qafqazlı qızarmış halda üzrxahlıq edib, çıxıb papirosu çöldə çəkir.* F.Köçərli.

**QAĞ** *dan.* b a x **vağ** 2-ci mənada.

**QAĞA¹** *is.* Uşaq dilində: hər cür şirni, dadlı, yeməli şey.

**QAĞA²** *is. dan.* Hörmət üçün böyük qardaşa, əmiyə, dayıya və ümumiyyətlə, yaxın adama deyilir. *Ay qağa, nə yatmısan, evimi yıxıblar, dur görək bu nə işdir?* Mir Cəlal. [Bacısı Şamoya:] *Sənə pay saxlamışam, qağa, – deyə dəsmalının ucunda olan düyünçəni onun qabağına açardı.* S.Rəhimov.

**QAĞA³** *is.* Dimdik. [Piri Fani:] *Simurq adında bir quş uçub gələr, bu ağacda məskən edər, onu qoruyar. Sizlərdən hər biriniz özünüz üçün nə istəsəniz, Simurq qağası ilə dərib atar.* S.S.Axundov.

**QAĞAYI** *is. zool.* Dəniz sahilində yuvalayıb, sahil suları üzərində uçan və balıqla qidalanan iri qanadlı dəniz quşu. *Göy dənizim, ləpələrin qatar-qatar; Yoxsa qanad çalıb keçən qağayılardır?* R.Rza.

**QAĞAZLANMAQ** b a x **qazlanmaq** 3-cü mənada. [Yasavul] *öz tay-tuşunun yanında da "Göyərçinin canı üçün, Göyərçinin ölmüşünə", – deyə and içər və bununla da qağazlanardı.* S.Rəhimov.

**QAĞILDAMA** "Qağıldamaq"dan *f.is.*

**QAĞILDAMAQ** *f.* Qaz kimi səs çıxarmaq, qağayı səsinə bənzər səs çıxarmaq.

**QAĞILDAŞMA** "Qağıldaşmaq"dan *f.is.*

**QAĞILDAŞMAQ** *qarş.* Ağız-ağıza verib hamı birdən qağıldamaq, bağırışmaq. *Qarğa kimi çox da qağıldaşmayın; Ay cücələr, bəsdi, cırıldaşmayın!* Ə.Nəzmi.

**QAĞILDATMA** "Qağıldatmaq"dan *f.is.*

**QAĞILDATMAQ** *icb.* Qağıltı səsi çıxartdırmaq. *Qazları qağıldatmaq.*

**QAĞILTI** *is.* Qaz və qağayı kimi quşların bağırtısı.

**QAĞLA** *is. məh.* Müxtəlif həcmdə olan şəkilcə küpəoxşar saxsı qab.

**QAHAL** *is. məh.* Mal-qaranın saxlandığı, ətrafı çəpərli və ya hasarlı üstüaçıq yer; ağıl. *Bu gün Bəxti də evdə yatmayıb, özünü mal-qaranın qahalına verdi.* S.Rəhimov.

**QAH-QAH** *zərf* Qəhqəhə ilə, bərkdən. *Əl-ələ çalanda, qah-qah güləndə; Əyləşib qalanda, pünhan olanda; Deyib danışdığı yadıma düşdü.* Aşıq Hüseyn. *Qah-qah gülüş getdi; Asdım dəstəyi; Nəfəsimi dərməmiş, dring-dring yenə zəng oldu.* R.Rza. // *is.* Qəhqəhə. ☐ **Qah-qah etmək (çəkmək)** – bərkdən qəhqəhə ilə gülmək (çox vaxt "**qah-qah çəkib gülmək**" şəklində işlənir). [İskəndər:] *Allahın iti də mənim sözümə baxmır, nə qədər elədim, içəri girmədi. Xa... xa... xa...* (*qah-qah çəkib gülür*). C.Məmmədquluzadə. *Gördük vədlərdən təkcə söz qalıb; Zülm qah-qah çəkir, haqsa hönkürür.* B.Vahabzadə.

**QAHMAR** *is. məh.* Tərəfdar, arxa, kömək, havadar. *Qahmarımız olmadı nə arxada, nə öndə..* B.Vahabzadə. ☐ **Qahmar çıxmaq** – kömək çıxmaq, tərəfini saxlamaq, havadarlıq etmək. [Səfərəli:] *Çarə yolunu düşünmüşük. Siz ancaq ilqar verin ki, bizə qahmar çıxacaqsınız.* Çəmənzəminli. *Dostlar özlərini yığışdırıb, İskəndərə qahmar çıxınca, kişini camaat qabağında mühakimə elədilər.* Mir Cəlal.

**QAHMARÇI** *is. məh.* Tərəfdar, havadar, tərəf saxlayan.

**QAHMARÇILIQ** *is. məh.* Tərəfgirlik, havadarlıq, tərəf saxlama.

**QAX** *is.* Qurudulmuş meyvə. *Alma qaxı. Armud qaxı. Ərik qaxı. – Pul yoxdur, toyuq, ördək, qax, qoz ki vardır, bunları gətirin borclarınıza hesab edək.* S.S.Axundov. *Vaxtında yığıb .. qax kəsməsələr, bunu* [*meyvəni*] *yığıb-yığışdırmaq olmayacaq.* Ə.Əbülhəsən.

**QAXAC** *is.* 1. Günəşdə və ya başqa üsul ilə qurudulmuş ət. ☐ **Qaxac etmək** – günəşdə və ya başqa üsul ilə qurutmaq (əti).

2. *məc.* Çox quru və ya qurudulmuş şey haqqında. ☐ **Qaxac olmaq, qaxaca dönmək** – b a x **qaxaclamaq**. *Çörək gün altında quruyub, qaxaca dönmüşdü.* Ə.Əbülhəsən.

3. *məc.* Çox arıq və cansız adam haqqında.

**QAXACÇI** *is.* Qaxac hazırlayan adam.

**QAXACIMA** "Qaxacımaq"dan *f.is.*

**QAXACIMAQ** *f.* 1. Qaxaca dönmək, çox qurumaq.

2. *məc.* Arıqlamaq, zəifləmək, qurumaq.

**QAXACITMA** "Qaxacıtmaq"dan *f.is.*

**QAXACITMAQ** *f.* 1. Əti günəşdə və ya başqa bir üsul ilə qurutmaq, qaxac eləmək. *Əti günəş qabağında qaxacıdırlar.*

2. *məc.* Soyuqdan dondurmaq, qurutmaq. *Zəhrimara qalmışın soyuğu da adamı qaxacıdır, – deyə ağacı ilə sacın altından qabağına köz çəkdi.* S.Rəhimov.

**QAXACLAMAQ** *f.* Günəşdə və ya başqa bir üsul ilə qurutmaq, qaxac etmək.

**QAXANC** b a x **qaxınc**.

**QAXDIRMAQ** "Qaxmaq"dan *icb.*

**QAXILMA** "Qaxılmaq"dan *f.is.*

**QAXILMAQ** *f.* 1. *məch.* Vurulmaq, çırpılmaq, yerə çaxılmaq.

2. Çalınmaq, vurulmaq, sancılmaq, girdirilmək. *Yerə on paya qaxılmışdır.*

3. *məc.* Bir yerdə oturub qalmaq. *Bir yerdə qaxıl, tərpənmə.* – [Kərəməli:] *Mən .. yükün üstünə qaxılmışam. Dartıb salan olmasa, yıxılan deyiləm.* M.F.Axundzadə.

**QAXINC** *is.* Edilən yaxşılığı adamın üzünə vurma, minnət qoyma, tənə etmə. ☐ **(Başına) qaxınc etmək** – etdiyi yaxşılığı başa vurmaq. [Səltənət:] *Gör mənim başıma nəyi qaxınc edirlər. Gör mənə kim qaxınc edir!* Mir Cəlal. *Qazanxan öz-özünə:* "*Yox, yox, bu, mənim başıma qaxınc olar, bundansa, ölüm yeydir*" *– deyə düşündü.* M.Rzaquluzadə.

**QAXIŞ** *is.* Qaxma; qaxmaq işi və tərzi.

**QAXMA** *is.* 1. "Qaxmaq"dan *f.is.*

2. Yerə qaxılan ucu yonulmuş ağac parçası. *Atı hörükləyib qaxmaya bağla.*

3. Metal lövhələr üzərinə qəlib ilə vurulub açılan naxış. *Bu naxışlar qazma deyil, qaxmadır.*

**QAXMAQ** *f.* 1. Var gücü ilə bir şeyi bir yerə vurmaq, çırpmaq. *Boşqabı yerə qaxıb sındırdı.*

2. Çalmaq, vurmaq, sancmaq, girdirmək. *Mıxı divara qaxmaq.*

◊ **Başa qaxmaq** – b a x **baş**.

**QAXSIMA** "Qaxsımaq"dan *f.is.*

**QAXSIMAQ** *f.* Köhnəlib qoxumaq; acı tam vermək. *Pendir açıq qalıb qaxsımışdır. Bu yağ, deyəsən, qaxsımışdır.*

**QAXSIMIŞ** *f.sif.* Köhnəlib qoxumuş və tamı acılaşmış. *Hopduqca səhranın gövdəsinə su; Tərlədi qaxsımış bir bədən kimi.* S.Vurğun.

**QAXSITMA** "Qaxsıtmaq"dan *f.is.*

**QAXSITMAQ** *f.* Çox saxlayaraq iyləndirmək, acılaşdırmaq; qaxsımasına bais olmaq. *Yağı ağzı açıq qoyub qaxsıtmaq.*

**QAİB** [*ər.*] 1. Olmayan, hazır olmayan, gəlməmiş, gözdən uzaqda olan (*hazır* müqabili). *Bu gün məktəbdə bir nəfər də olsun, qaib yoxdur.* ☐ **Qaib olmaq** – yox olmaq, gözdən itmək. *O gündən kim, gözümdən qaib olmuş mahi-rüxsarın; Olubdur çeşmimə tarik yeksər bu cahan sənsiz.* S.Ə.Şirvani. *İyirmi-iyirmi beş igid hərəsi bir at eşiyə çəkib çaparaq mindilər və qaib oldular.* C.Məmmədquluzadə. *Ceyran söz anlar kimi, sıçrayıb, meşədə qaib olur.* Çəmənzəminli.

2. Qrammatikada: üçüncü şəxs, haqqında danışılan şəxs. *Azərbaycan dilində "o" qaib əvəzliyidir.*

**QAİBANƏ** *zərf* [*ər.* qaib və *fars.* ...anə] Görməyərək və görünməyərək, görmədən, gizlidən, arxadan, qiyabi surətdə, şəxsən görmədiyi və tanımadığı halda. *O adama qaibanə məhəbbətim var. – Qıllam sənə iştə bir vəsiyyət; Yad et məni, qaibanə yad et.* A.Səhhət. *Bu şəxsi də mən o vaxtdan qaibanə tanıyırdım.* C.Məmmədquluzadə. *Sənin sədaqətini Vahidə özüm demişəm; O da sevir, gözəlim, indi qaibanə səni.* Ə.Vahid.

**QAİDƏ** *is.* [*ər.*] 1. *köhn.* Bir şeyin altlığı, ayaqlığı, oturacağı. *Sütunun qaidəsi. Güldanın qaidəsi.*

2. B a x **qayda**. [Ağa Hüseyn Xəlilə:] *Mən istəyirəm ki, ticarətin hər bir yolunu və qaidəsini sənə öyrədim.* Ə.Haqverdiyev.

**QAİL** [*ər.*] *köhn.* İnanan, razı olan. *Pərvanə də sən tək şəmə maildir; Nə qədər ki, cövr eyləsə, qaildir.* Q.Zakir. *Küfrümə hökm eyləməyin zur ilə; Qaili-Quranəm, a şirvanlılar!* M.Ə.Sabir. [Şeyx Sənan:] *Sən neçin həp sükutə mailsən; Söylə bir, hankı dinə qailsən?* H.Cavid. ☐ **Qail olmaq** – razı olmaq, inamı olmaq, inanmaq. [Mirzə Fətəli:] *Mən elmi-kimyaya qailəm, nəinki daşın dönüb qızıl olmağına.* Ə.Haqverdiyev. *Bir sözüm var sənə pünhan deməli; Qail olsan, deyim, gül sənə qurban!* Aşıq Ələsgər.

**QAİLLİK** *is.* İnam, inanma, etiqad etmə. *Əzizim, əgər mənim sözümə qailliyin olacaqsa, deyim.* C.Məmmədquluzadə.

**QAİM** *sif.* [*ər.*] *klas.* Sabit, davamlı, möhkəm. *Min şükr ki, möhkəməm vəfadə; Hicranına qaiməm cəfadə.* Məsihi. ☐ **Qaim olmaq** – 1) sabit olmaq, sabitləşmək. *Səndən dilərəm mədəd, ki daim; Təmkinim ola səninlə qaim.* Füzuli. *Kim su əgər tərpənsə, axsa daim; Təravəti olar o vaxt qaim.* A.Səhhət; 2) yerini tutmaq.

**QAİMƏ** *is.* [*ər.*] 1. Alıcıya göndərilən və ya buraxılan malların adı, növü, miqdarı, qiyməti yazılmış siyahını göstərən sənəd.

2. *köhn.* Uzun kağız üzərində yazılmış əmrnamə.

3. Qılıncın dəstəyi.

**QAİMMƏQAM** *is.* [*ər.*] Türkiyədə: 1) qəza rəisi; 2) *köhn.* mayor rütbəsi ilə polkovnik rütbəsi arasında hərbi rütbə; podpolkovnik.

**QAİMMƏQAMLIQ** *is.* Türkiyədə: 1) bir qaimməqamın idarəsi altında olan əyalət, qəza; 2) qaimməqam vəzifəsi; 3) *köhn.* podpolkovnik rütbəsi.

**QAQAUZ** *is.* Moldova və Ukraynada, həmçinin Rumıniya və Bolqarıstanda yaşayan türkdilli xalq və bu xalqa mənsub adam. *Haray, ey qaqauz, türk, kazak, balkar! Ey başqırd, ey türkmən, susursan niyə? Qovuşsun Türküstan, Atatürkiyə!* X.Rza.

**QAQAUZCA** *sif.* və *zərf* Qaqauz dilində.

**QAQQA** b a x **qağa**[1]. *Nazlı bala, göyçək uşaq, gəl mənə*; *Yaxşı-yaxşı qaqqa verim mən sənə.* A.Səhhət.

**QAQQANA(Q)** *is.* Qaqqıltı. *Pilləkəni titrətdi muştuluqçu qonşu qızın qaqqanası.* R.Rza. ☐ **Qaqqanaq çalmaq** – 1) qaqqıldamaq. *Araba silkinər və cırıldayar, toyuqcücə qaqqanaq çalıb qaqqıldaşmağa başla-*

*yardı.* H.Sarabski; 2) qaqqıltı (qəhqəhə) ilə gülmək.

**QAQQILDAMA** "Qaqqıldamaq"dan *f.is.*

**QAQQILDAMAQ** *f.* 1. Çığırma, qaqqıltı salmaq (toyuq və quşlar haqqında).

2. Bərkdən gülmək, qəhqəhə ilə gülmək. *Övci-fəzadə görərək boynunu; Səhnədə qaqqıldayıram indi mən.* M.Ə.Sabir. *Zəhra xanım əllərini bir-birinə vurub qaqqıldadı.* A.Şaiq. *Muradlı onun üzünə baxıb qeyri-adi halda qaqqıldadı.* Mir Cəlal.

**QAQQILDAŞMA** "Qaqqıldaşmaq"dan *f.is.*

**QAQQILDAŞMAQ** *qarş.* 1. Hamı birdən qaqqıldamaq. *Qatarlaşıb nə diyardan gəlirsiz; Qaqqıldaşa-qaqqıldaşa* (z.) *durnalar?* Q.Zakir. *Kəkilli durnalar hey qatar-qatar; Qaqqıldaşıb keçir, açılmış bahar.* R.Rza.

2. Qəhqəhə ilə gülmək, bir-birinə qoşulub bərkdən gülmək. *Qaqqıldaşa-qaqqıldaşa gülərlər; Canlar alan sövtə-sədayə bir bax.* Q.Zakir. *Bir deyib, bir gülüb, aşıb-daşırlar; Bəzən kəklik kimi qaqqıldaşırlar.* S.Vurğun.

**QAQQILDATMAQ** *icb.* Qaqqıldamağa məcbur etmək.

**QAQQILTI** *is.* 1. Toyuq, kəklik, durna çığırtısı. *Qırqovulu nişana aldıqda qaqqıltı ilə uçub uzaqlaşır.* S.S.Axundov. *Orda-burda tutulan toyuqların qaqqıltısı, kəndli arvadlarının qarğış və nifrini kəndlə bir olmuşdu.* Çəmənzəminli.

2. Qəhqəhə; qəhqəhə ilə gülüş. *Bundan sonra bəylər qaqqıltı ilə gülməyə başladılar.* S.S.Axundov. *Cəlal yenə də özünü saxlaya bilməyib qaqqıltı ilə güləndə, acığından Tahirin əlləri titrəməyə başladı.* M.Hüseyn.

**QAQUM** *is.* [*ər.*] Pişik cinsindən olan bozqara quyruqlu xəzlik heyvan.

**QAL** *is.* [*ər.*] *köhn.* Qarışıqlıq, hay-küy, çığır-bağır, mübahisə, qovğa. *İgidin başı qalda gərək.* (Ata. sözü). *Vaqif ki düşübdür əqlü kəmaldan; Əskik olmaz başı qovğadan, qaldan.* M.P.Vaqif. [Əlibaba:] *Gərək qalda olsun igidin başı; Ancaq unutmasın dostu, yoldaşı.* Z.Xəlil.

**QALA** *is.* [*ər.*] 1. Uzun müddət içində qapanıb düşmənə müqavimət göstərmək üçün möhkəm müdafiə tikililəri və vasitələri olan istehkam (məntəqə). *Qərb tərəfdə uzanan dağlar Əsgəran qalasına çatdıqda .. bir-birinə yaxınlaşırlar.* S.S.Axundov. *Hava işıqlandıqca Girdman qalasının möhtəşəm bürcləri aydın görünməyə başlayırdı.* M.Hüseyn.

2. Qədimdə qala rolu oynamış yüksək və əksərən dairəvi şəkildə olan tikili; bürc. *Qız qalası. Mərdəkan qalası. – Daşaltı çayının daş dələn səsi; Şuşa qalasının "Ərim gəldi"si..* B.Vahabzadə. // Qüllə. *Qaladan azan səsini eşidərkən hər kəs öz evinə gedib süfrəyə hücum başlardı.* H.Sarabski.

3. Həbsxana, dustaqxana, qazamat.

4. *köhn.* Şəhər. [Ziba xanım:] *..Xan qala divarında bəy uşaqlarını bir-biri ilə güləşdirir.* M.F.Axundzadə.

5. *məc.* Dayaq, arxa, müdafiəçi, istinadgah mənasında.

◊ **Uçan qala** – uzaq məsafələrə uça bilən ağır bombardman təyyarəsi.

**QALABƏND** *sif.* [*ər.* qələ və *fars.* bənd] *köhn.* Yalnız şəhər içərisində gəzib, ondan kənara çıxmamağa məhkum edilən günahkar, müqəssir. *Əgər Günay bu döngədəki evlərin birində, qarının yanında qaravaş idisə, o da qalabənd olub bu şəhərdə qalacaqdı.* Ə.Məmmədxanlı.

**QALABƏNDLİK** *is. köhn.* 1. Qalabənd cəzası (b a x **qalabənd**).

2. Qalada qapanıb qalma, qalanın mühasirədə olması. *Üç ay qalabəndlik olub, heç tərəfdən qaladakı qoşuna kömək gəlmədi.* "Dərbəndnamə".

**QALABƏYİ** *is. tar.* Qala (şəhər) hakimi, şəhər böyüyü, şəhərin baş hakimi. *..Həmədan qalasını Azərbaycan qoşununun üzünə açmaq istəməyən qalabəyini darvazanın qabağında asdı(lar).* M.S.Ordubadi. *Qalabəyi paltarını geyinməyə başladı.* M.Hüseyn. *Keçmişdə Bakıda bir qalabəyi Qasım bəy vardı.* H.Sarabski.

**QALABƏYİLİK** *is. tar.* Qalabəyi vəzifəsi, işi.

**QALÁC** [*rus.* калач] Kömbə (çörək). *Dişləri tutmadı yavan qalacı; Çünki həm bərk idi və həm də acı.* Ə.Qəmküsar.

**QALAÇA** *is.* Kişik müdafiə tikilisi; xırda qala. *Qalaça küncünə qısılan şahın; Xalqı palçıq kimi tapdanacaqdır.* M.Araz.

**QALAĞAN** b a x **qanqal**. *Düşdü bu fikrə eşşəyi-nadan; Ta gedib otlasın o da qalağan.* S.Ə.Şirvani.

**QALÁKTİKA** [*yun.*] *astr.* Ulduzlar sistemi – bütün ulduzların və qaz, toz dumanlıqlarının hamısının birlikdə adı. *Məlumdur ki, nəhayətsiz kainatda saysız çox ulduz aləmləri vardır. Bu ulduz aləmlərinə elmdə qalaktika deyilir*. Hüseynov.

**QALAQ** *is*. Bir yerə qalanmış, üst-üstə yığılmış, yığın halında olan şey; yığın, topa. *Odun qalağı. Dərz qalağı. Qar qalağı. Torpaq, qum qalağı. – Məmmədəli əminin həyətinin aşağı tərəfində bir yekə gərmə qalağı var idi.* C.Məmmədquluzadə. *Onlar uçuq toyuq hinini palçıqlayır və həyətin bir guşəsinə yapılmış təzəkləri qalağa yığırdılar.* M.İbrahimov. *Yonca qalaqlarının arasına çatanda, Tapdıq: – Mina, hara tələsirsən? – deyə onu saxladı.* Ə.Əbülhəsən. ☐ **Qalaq vurmaq** – koma yığmaq, üst-üstə yığmaq, qalaqlamaq. *Tayları qalaq vurmaq.*

**qalaq-qalaq** *zərf* Qalaqlanmış halda, üst-üstə yığılmış halda; yığın-yığın, topa-topa, üst-üstə. *Hətəmxanın tayları dağ kimi qalaq-qalaq göründüyü halda, yenə də arası kəsilmədən ulaqlarla dərz çəkilirdi.* S.Rəhimov. *Dəniz coşdu zaman-zaman şiddətlənərək; Qalaq-qalaq qar yığını çıxdı qurşağa*. S.Vurğun. *Pambıq kimi qalaq-qalaq yığılıb; Oxşursunuz qarlı dağa, buludlar!* H.K.Sanılı.

**QALAQLAMA** “Qalaqlamaq”dan *f.is.*

**QALAQLAMAQ** *f.* Qalaq vurmaq, komalamaq, bir yerə toplamaq, üst-üstə yığmaq. *Taxıl dərzlərini qalaqlamaq. – Bəziləri isə dizi üstə oturub yenicə gətirdikləri quru odunu qalaqlayırdılar.* M.Hüseyn.

**QALAQLANMA** “Qalaqlanmaq”dan *f.is.*

**QALAQLANMAQ** *məch.* Qalaq vurulmaq, komalanmaq, bir yerə toplanmaq, üst-üstə yığılmaq. *Qara damlar adda-budda salınmışdı, dal tərəflərində təzək qalaqlanmışdı.* Çəmənzəminli. *Görünürdü güclü bir qar gələcək, qar qarın üstünə qalaqlanacaq, lütlənən ağaclar qarla yüklənəcəkdir.* S.Rəhimov.

**QALAQLANMIŞ** *f.sif.* Qalaq vurulmuş, komalanmış, üst-üstə yığılmış. *Dəniz üzərində bir-birinin üstünə qalaqlanmış ağ buludlar ağır-ağır hərəkət edib cənuba doğru sürünürdü.* M.Hüseyn. *Bir yığın bulud layları göyün tən ortasında bir-biri üzərinə qalaqlanmışdı.* Ə.Məmmədxanlı.

**QALAQLATMA** “Qalaqlatmaq”dan *f.is.*

**QALAQLATMAQ** *icb.* Qalaq vurdurmaq, üst-üstə yığdırmaq, qalaqlama işi gördürmək.

**QALAMA** “Qalamaq”dan *f.is.* ☐ **Bir qalama** – ağzına qədər dolu, dopdolu, çoxlu. [Pivəxanada] *oturanlar hər stəkana bir qalama nəlbəki noxudu yeyib qabığını da tökürdülər yerə.* Qantəmir.

**QALAMAQ** *f.* 1. Bir-birinin üstünə yığmaq, qalaq-qalaq yığmaq, toplamaq, komalamaq. *Odunları qalamaq. Kərpici qalamaq. – Vəliqulu boş nimçələri bir-birinin üstünə qalayıb istəyirdi otaqdan qaça aşpazxanaya.* C.Məmmədquluzadə.

2. Ocağa, sobaya və s.-yə odun, kömür və s. qoyub yandırmaq, alovlandırmaq, alışdırmaq. *Ocaq qalamaq. Təndir qalamaq. Buxarını qalamaq.* – [Müəllim] *Tellinin axşam gətirdiyi südlə şam etmiş, axırda sobasını yenidən qalayıb yatağına uzanmışdı.* S.Hüseyn. *Fəcrin soyuq tonqalı yananda; Mən də tonqal qaladım gah dağda, gah aranda.* Ə.Cəmil.

**QALANMA** “Qalanmaq”dan *f.is.*

**QALANMAQ** *məch.* 1. Üst-üstə yığılmaq, topalanmaq, komalanmaq. *Ot biçildikdən sonra, qalanıb taya vuruldu. – Sol tərəfdə divara səmt qalanmışdı çiy kərpic, vəssəlam.* C.Məmmədquluzadə. *Arabaya ot qalanar, dağ olar; Kəndlilərin onda kefi çağ olar.* A.Səhhət.

2. Yandırılmaq, alovlandırılmaq; odun, kömür və s. qoyulub alışdırılmaq. *Odlara qalandım, dedim: Allahə təvəkkül!* Ə.Nəzmi. *Ocağa qalanmış odunlar yanıb qurtardığı üçün qaranlıq yenə qanadlarını gərirdi.* Ə.Vəliyev.

3. *t-siz*. Yanmaq, alovlanmaq. *Canım eşq oduna qalanmaq gərək.* M.P.Vaqif.

**QALANTERÍYA** [*fr.*] Müxtəlif xırda bəzək və tualet malları (daraq, muncuq, boyunbağı, bəzək sancağı, lent və s.); xərəziyyat, xərəzi malları.

**QALAT(DIR)MA** “Qalat(dır)maq”dan *f.is.*

**QALAT(DIR)MAQ** *icb.* 1. Bir-birinin üstünə yığdırmaq, komalatmaq. *Odunları bir yerə qalatmaq*.

2. Ocağa, sobaya və s.-yə odun, kömür qoydurub yandırtmaq. *Ocağı qalatmaq. Tən-*

*diri qalatmaq*. – *Hər şeyin çarəsi var!* – *deyə Vaqif laləni çağırıb buxarını təzədən qalatdırdı*. Çəmənzəminli. *Havada kəsici bir sazaq olduğundan, dəmir peçi də qalatdırmışdım.* M.İbrahimov.

**QALAY** *is.* Kimyəvi element – tezəriyən yumşaq, gümüşü ağ metal. *Arxeoloji qazıntılar göstərir ki, qədimdə birinci alətlər qayırmaq üçün qalaydan istifadə edirmişlər..* // Mis qab-qacağın üzünə çəkilən incə qalay təbəqəsi. *Qazanın qalayı getmişdir*.

**QALAYÇI** *is.* Mis qabları qalaylayan usta; qabağardan. [Evin qadınları] *mis qab-qacağı qalayçıya göndərib ağartdırır*(*dılar*). H.Sarabski.

**QALAYÇILIQ** *is.* Qalayçının işi, sənəti.

**QALAYLAMA** "Qalaylamaq"dan *f.is.*

**QALAYLAMAQ** *f.* 1. Mis qabları pasdan qorumaq üçün onların üzünə xüsusi üsullarla qalay çəkmək, onları qalayla ağartmaq. *Qazanı qalaylamaq*.

2. *məch.* Səthi və üzdən zinət vermək.

**QALAYLANMA** "Qalaylanmaq"dan *f.is.*

**QALAYLANMAQ** *məch.* Qalay çəkilmək, qalay vurulmaq, qalayla ağardılmaq. *Mis qab-qacaq qalaylanmışdır.*

**QALAYLANMIŞ** *f.sif.* bax **qalaylı**. *Qalaylanmış qazan*. – *Səhləbçilər yenicə qalaylanmış iri çaydanlarını sallayaraq:* "*Səlləbisinə məlhəmi!*" – *deyə bağırırlar*. Çəmənzəminli. *Qızxanım nənə qalaylanmış parçı .. Almurad babaya verdi.* İ.Əfəndiyev. *Qapılar ay işığı ilə qalaylanmış kimi yuxarıdan par-par parıldayırdı.* Mir Cəlal.

**QALAYLATMA** "Qalaylatmaq"dan *f.is.*

**QALAYLATMAQ** *icb.* Qalay çəkdirmək, qalaylama işi gördürmək, ağartdırmaq. *Qazanı qalaylatmağa vermək.*

**QALAYLI** *sif.* 1. Üzərinə qalay vurulmuş, qalayla ağardılmış. *Qalaylı qazan. Qalaylı tava.*

2. *məc.* Üzdən bəzədilmiş, zahirən gözəl; saxta.

**QALDIRICI** 1. *sif.* Qaldıran, ağırlıq qaldıran. *Qaldırıcı mexanizm*. – *Yeni tikilmiş buruqda qaldırıcı maşın təzə qazma borularını çəkib yuxarı apardı*. M.Hüseyn. *Yuxarıda qaldırıcı kran hərlənərək xortumunu suyun üzərinə salladı.* Ə.Sadıq.

2. *is.* Ağırlıq qaldıran mexanizm, qurğu. *Polad qaldırıcı yerə enərək, çanağını qumla doldurub cəld yuxarı qalxır.*

**QALDIRILMA** "Qaldırılmaq"dan *f.is.*

**QALDIRILMAQ** "Qaldırmaq"dan *məch. Yerə tökülmüş şeylər qaldırıldı. Lövbər qaldırıldı, gəmi yola düşdü. Bayraqlar qaldırıldı. Divar bir metr yuxarı qaldırıldı.*

**QALDIRIM** *is. köhn.* Səki. *Gecəki yağmurlardan çuxurlar göl-göl durmuş, ensiz bir qaldırım üzərində gəzirdim.* A.Şaiq. [Rüstəm bəy və Çingiz] *küçəyə çıxdılar, hava çiskindi. Geniş qaldırımların üstə çıraqların işığı uzun əkslər buraxmışdı.* Çəmənzəminli. *Onlar dəstələrlə institutlardan, idarələrdən, zavodlardan çıxıb tramvaylara dolur, qaldırımlarda yürüyür, sevinclə qaynayırlar*. Mir Cəlal.

**QALDIRMA** "Qaldırmaq"dan *f.is.*

**QALDIRMAQ** *f.* 1. Əyilərək yerdən götürmək, qalxızmaq. *Kitabı qaldırmaq. Daşı qaldırmaq. Yerə düşmüş yaylığı qaldırmaq. Uşağı yerdən qaldır.* // Aşağıdan yuxarıya çıxartmaq, yuxarıya aparmaq (dalında, çiynində, əlində, yaxud qaldırıcı maşın və s. vasitəsilə). *Şeyləri üçüncü mərtəbəyə qaldırmaq. Lift bizi yeddinci mərtəbəyə qaldırdı.* // Dikəltmək. *Bayrağı qaldırmaq.* – *Musa birdən başını yuxarı qaldırdı*. M.Hüseyn.

2. Bir şeyə daha yuxarı, daha yüksək vəziyyət, ya səviyyə vermək. *Pərdəni qaldırmaq. Ayağını qaldırmaq. Əlini qaldırmaq. Divarı yarım metr qaldırmaq. Suyun səviyyəsini qaldırmaq.* – *Sarxan əlindəki fənəri yuxarı qaldırdı.* M.Hüseyn. *Adamlar yaxalarını bərk-bərk bağlayıb, boyunluqlarını qaldırır*. Mir Cəlal. // Yüksəltmək, ucaltmaq. *Qırmızı günəşdən ağ evlər tikən; Dünyanı yüksəldib qaldıranıq biz*. H.K.Sanılı. // *məc.* Hörmətə mindirmək, ucaltmaq, daha hörmətli etmək. *Bu gözəl hərəkəti onu camaatın gözündə daha da qaldırdı*.

3. Yükləyib daşımaq, götürmək, aparmaq. *Tayları anbardan mağazaya qaldırdılar. Meyiti bu gün qaldıracaqlar.*

4. Ayaqlandırmaq, həyəcanlandırmaq, üzə durğuzmaq, təhrik etmək, sövq etmək. *Qardaşı Nəbi bizim başımıza oyun gətirdi. Tuturuq, qazamatdan qaçır, camaatı bəylərin və hökumətin üzünə qaldırır*. "Qaçaq Nəbi".

5. Yük götürə bilmək. *O qədər yükü bu heyvan qaldıra bilməz.*

6. Yox etmək, ortadan götürmək, bərtərəf etmək. *Maneələri qaldırmaq. Aradakı səddi qaldırmaq.*

7. Sağaltmaq, yataqdan durğuzmaq. *Həkim beş gündə məni yataqdan qaldırdı.*

8. Bir sıra isimlərin yanına gətirilərək, ismin ifadə etdiyi mənada mürəkkəb feillər və ifadələr düzəldilir; məs.: üsyan qaldırmaq, məsələ qaldırmaq, şivən qaldırmaq.

**QALDIRTMAQ** "Qaldırmaq"dan *icb.*

**QALERÉYA** [*fr.*] 1. Binanın ayrı-ayrı hissələrini bir-biri ilə birləşdirən örtülü uzun eyvan. *Şüşəbənd qalereya.*

2. Qala tikililərini, yaxud şaxtanın ayrı-ayrı hissələrini bir-biri ilə birləşdirən yeraltı yol.

3. Teatrın, ucuz qiymətli yerlər olan ən yuxarı yarusu.

4. İncəsənət əsərlərini nümayiş etdirmək üçün bina. *Şəkil qalereyası.* // İncəsənət, əsasən rəsm və heykəltəraşlıq muzeyi. *Tretyakov qalereyası. Drezden qalereyası.*

5. *məc.* Uzun sıra, silsilə. *M.F.Axundzadə tiplərinin qalereyası.*

**QALEREYALI** *sif.* Qalereyası olan.

**QALÉT** [*fr.*] Peçenye növü. *Uzun, büllur vazlardakı mürəbbədən, qənddən çaya saldılar, qaletdən yeyib çaydan içdilər.* S.Rəhman.

**QALĞI** b a x **qalıq** 1-ci mənada.

**QALXAQ** b a x **qalxıq**. *Balacayev tükü yolunmuş sısqa cücəyə, .. ortaboylu, çiyinləri qalxaq Sübhanverdizadə isə xortumlu bir filə dönmüşdü.* S.Rəhimov.

**QALXAN** *is. köhn.* Qədim müharibələrdə qılınc və s. zərbəsindən qorunmaq üçün əldə tutulan dairə və ya düzbucaq şəkilli sipər (ağacdan, metaldan, dəridən qayrılardı). *Qədim zamanda qılınc və qalxan müharibənin başlıca alətləri idi.* – [Mülkədar:] *Öz hesabıma beş yüz təzə qılınc, bir o qədər də qalxan tədarük etmişəm.* M.Hüseyn. *O gündən şair, Afaq ilə bərabər bağçalarını paslanmış nizə, qalxan və qılınc parçalarından təmizlədilər.* Ə.Məmmədxanlı. // Sipər.

**QALXANABƏNZƏR, QALXANAOXŞAR** b a x **qalxanvari**.

**QALXANCIQ** *is. zool.* Qın, sərt örtü (qabıq). *Yumşaqbədənlilərin bəziləri yastı formada olub, arxalarında qabıq əvəzinə qalxancıq vardır.* "Zoologiya".

**QALXANQULAQ** *sif.* Yekəqulaq, qulaqları böyük; iri qulaqlı.

**QALXANLI** *sif.* Qalxanla silahlanmış.

**QALXANLICA** *is. məh.* Quru yamaclarda bitən bir bitki.

**QALXANŞƏKİLLİ** b a x **qalxanvari**.

**QALXANVARİ** *sif.* Şəkilcə qalxana oxşayan.

◊ **Qalxanvari vəzilər** *anat.* – insanın və onurğalı heyvanların orqanizmində maddələr mübadiləsində iştirak edən daxili sekresiya vəziləri.

**QALXIQ** *sif.* Qalxmış halda olan, dik (*yatıq* müqabili). *Onun .. şinelinin qalxıq yaxasından üzü və çuxura düşmüş gözləri də güclə görünürdü.* Ə.Əbülhəsən.

**QALXINMA** "Qalxınmaq"dan *f.is.*

**QALXINMAQ** *f.* Qalxmaq, durmaq. *Birdən rus qızı yerindən qalxındı, sanki canının ağrısından Ulduzun əllərini bərk-bərk sıxdı.* Ə.Məmmədxanlı.

**QALXIŞMA** "Qalxışmaq"dan *f.is.*

**QALXIŞMAQ** *f.* 1. Hamı birdən ayağa qalxmaq.

2. B a x **qalxmaq** 5-ci mənada. [Nizami:] *Qızıl Arslanın Məmundan alaraq bizə aşılamaq istədiyi yanlış fikirlərin birisi də Babəkin dinə qarşı yox, təriqətlərə qarşı üsyan etməsinin zəruri olduğunu isbata qalxışmasıdır.* M.S.Ordubadi.

**QALXIZMA** "Qalxızmaq"dan *f.is.*

**QALXIZMAQ** b a x **qaldırmaq** 1-ci mənada.

**QALXMA** "Qalxmaq"dan *f.is.*

**QALXMAQ** *f.* 1. Ayağa durmaq, dik vəziyyət almaq. *Müəllim sinfə girdikdə şagirdlər qalxdılar. Bütün salondakılar ayağa qalxdılar. Hamı yerindən qalxıb sıraya düzüldü.* – *Harın at qalxdı dik ayaq üstə; Ox dəyən ahu kimi tullandı.* A.Səhhət. *Gəlinlər, qızlar ağır-ağır enib qalxırdılar.* Çəmənzəminli. // Yuxudan ayılıb yatağından durmaq. *Uşaqlar çoxdan qalxıblar.* – *Gecənin yarısı qalxıb yataqdan; Tökdüm qabağıma şeirlərimi.* B.Vahabzadə.

2. *məc.* Sağalmaq. *Xəstə artıq qalxıbdır. Xəstə tez qalxana oxşamır.*

3. Bir şeyin üstünə, təpəsinə, başına çıxmaq; yuxarı çıxmaq, dırmaşmaq. *Dağa qalxmaq. – Gördüm ki, camaat axşam vaxtı seyrəngaha çıxıb, yol ilə başyuxarı qalxanlara tamaşa edirlər.* C.Məmmədquluzadə. *O heç bir şey olmamış kimi ağır addımlarla pilləkəni qalxıb göy məhəccərli eyvana çıxdı.* İ.Şıxlı. // Yüksəlmək. *Göyə qalxan və yerin təkinə enən dalğalarda nə sığınacaq yer, nə əl çatacaq bir çöp vardı.* M.İbrahimov. *Gün iki cida boyu qalxmışdı.* Mir Cəlal. // Daha yüksək bir vəziyyət almaq. *Pərdə qalxdı. Qaşları qalxdı.*

4. Qabarmaq, şişib böyümək. *Çiban dünənkinə nisbətən bir qədər qalxmışdır. – Relslər yanında torpaq bir girdab kimi köprüyüb qalxırdı.* Ə.Məmmədxanlı.

5. *məc.* Hərəkətə gəlmək, hərəkətə başlamaq, ayağa qalxmaq, qalxışmaq, qiyam etmək. *Mübarizəyə qalxmaq. Müdafiəyə qalxmaq. Bütün xalq işğalçılara qarşı qalxdı.*

6. Səviyyəsi artmaq, daha da yüksəlmək. *Çayın suyu qalxmışdır. Barometr qalxmışdır.* // Daha da güclənmək, artmaq. *Hərarət qalxmışdır. Uşağın qızdırması qalxmışdır.*

7. *məc.* Vəzifəsi, rütbəsi, mövqeyi, nüfuzu yüksəlmək, tərəqqi etmək, irəliləmək. *O, elm sahəsində xeyli qalxmışdır.*

8. Birdən başlamaq, qopmaq, ucalmaq, artmaq və s. mənasında olaraq, köməkçi feil kimi bir sıra isimlərin qabağına gətirilir. *Külək qalxdı. Toz qalxdı. Səs-küy qalxdı. – Zurna düzəldi. Dəf vuruldu. Çəpik səsi qalxdı.* Çəmənzəminli. *Dənizdə tufan qalxır. Xəzərin ağ köpüklü çılğın dalğaları sahili gəmirirdi.* M.Hüseyn.

**QALIQ** *is.* 1. Bir şeyin, işləndikdən sonra artıq qalmış hissəsi, parçası. *Yemək qalıqları. Xörəyin qalığı. – Dümbər papiros qalığını ayağı ilə basıb söndürdü.* S.Rəhman. // Tullantı. *İstehsalat qalıqları.*

2. Verginin və s.-nin vaxtında ödənilməmiş hissəsi. *Vergi qalığı.*

3. Keçmişdə olmuş bir şeyin qalmış izləri (bu mənada adətən cəm şəklində işlənir). *Qədim abidənin qalıqları. Heyvanların qazıntı halında tapılan qalıqları. Köhnə məişətin qalıqları. – Əxlaq kitabları və asari-ətiqə qalıqları heç bir ölkədə keçmişdə vaqe olan işləri lazımi tərtib və təfsil ilə ifadə edə bilməz.* A.Bakıxanov.

4. *riyaz.* Bir ədədi bir ədədə bölərkən qalan kəmiyyət.

**QALIQLI** *sif. riyaz.* Böldükdə qalıq qalan (b a x **qalıq** 4-cü mənada).

**QALIQSIZ** *sif. riyaz.* Böldükdə qalıq qalmayan (b a x **qalıq** 4-cü mənada).

**QALIM** *is.* Qalma, sağlıq, dirilik. *Dəli könlüm, məndən sənə əmanət; Demə bu dünyada qalım yaxşıdır.* Xəstə Qasım.

**QALIN** *sif.* 1. Kütləsi köndələn vəziyyətdə çox yer tutan, yoğun (*nazik* müqabili). *Qalın kitab. Qalın divar. Qalın döşək. Qalın gön.*

2. Bir-birinə çox yaxın ağaclardan, kollardan ibarət olan; sıx. *Gün çıxıb, dağ başından uçdu duman; Qaralırdı qalın, qara orman.* A.Səhhət. *Qalın meşə, yaşıl ot adam boyunda, gözəl quşların nəğmələri, iti bulaqların qıjıltısı, havanın təmizliyi insana ləzzət verir.* N.Nərimanov. *Saman və ot tayaları, qalın kol-kos, yaşıl ağaclar islandıqca havanı xoş bir ətirlə doldururdu.* M.İbrahimov. // Kəsif, qəliz, qeyri-şəffaf. [Müəllim] *lampasını keçirmişdi; otaq qalın bir qaranlığa büründüyündən nə yapdığını seçə bilmirdi.* S.Hüseyn.

3. *məc. dan.* Kobud, qaba.

**QALINBIĞLI** *sif.* Bığları yoğun olan. *Qalınbığlı kişi.*

**QALINCÁ** *sif.* Çox qalın. *Qalınca bir tir.* // Qalın. *Qısa adamın qalınca dodaqlarında istehzalı bir gülüş bilindi.* H.Nəzərli.

**QALINDODAQ** *sif.* Dodaqları qalın olan.

**QALINQABIQ** *sif.* Qabığı qalın olan. *Qalınqabıq qoz. Qalınqabıq püstə. Qalınqabıq qovun. – Otağım doludur sükutla; Sükutun içində mən qalınqabıq meyvə içində qalmış tum kimi.* R.Rza.

**QALINQAFALI** *sif.* Heç bir şey qanmayan, həssaslıqdan, real düşünmək qabiliyyətindən məhrum; küt, qanmaz, dərrakəsiz.

**QALINQAŞ** *sif.* Qaşları qalın olan.

**QALIN-QAYIM** *sif.* Canı bərk, ətli-canlı. *Xankişi bir qalın-qayım arvadı aralığa saldı.* Mir Cəlal.

**QALINLAMAQ** b a x **qalınlaşdırmaq**.

**QALINLATMAQ** b a x **qalınlaşdırmaq**.

**QALINLAŞDIRILMA** "Qalınlaşdırılmaq"dan *f.is.*

**QALINLAŞDIRILMAQ** *məch.* Daha qalın hala salınmaq, daha qalın edilmək.

**QALINLAŞDIRMA** "Qalınlaşdırmaq"dan *f.is.*

**QALINLAŞDIRMAQ** *f.* Daha qalın etmək. *Paltonun astarını qalınlaşdırmaq. Yorğanı qalınlaşdırmaq.*

**QALINLAŞMA** "Qalınlaşmaq"dan *f.is.*

**QALINLAŞMAQ** *f.* 1. Daha qalın olmaq. *Bu kətan yuyulduqda qalınlaşır.* // Getdikcə qalın olmaq, yoğunlaşmaq. *Zorxana milinin başı nazik idi, lakin getdikcə qalınlaşırdı, ucu isə yumru idi.* H.Sarabski.

2. Sıxlaşmaq, kəsifləşmək, çoxalmaq, gurlaşmaq. *Yavaş-yavaş payız qışa çevrilir, bacaların tüstüsü qalınlaşırdı.* M.İbrahimov. .. *Yuxarı qalxdıqca qar daha da qalınlaşır, sazaq adamın iliyinə işləyirdi.* İ.Şıxlı.

**QALINLIQ** *is.* 1. Qalın şeyin halı; yoğunluq (*naziklik* müqabili). *Parçanın qalınlığı. Ağacın qalınlığı. – Kərim baba .. bir qarış iki barmaq qalınlığında yaş çubuğu yonurdu.* A.Şaiq. *Dərin dərənin içi ilə qumluq aşağı axan suyun yanlarını kağız qalınlığında buz tuturdu.* S.Rəhimov.

2. Sıxlıq, sıx yer, keçilməz yer. *Meşənin qalınlığından keçmək olmur.*

**QALINLIQÖLÇƏN** *sif. xüs.* Müxtəlif şeylərin qalınlığını ölçən. *Qalınlıqölçən cihaz.*

**QALINTÜK(LÜ)** *sif.* Tükü qalın, sıx və çox olan. *Qalıntüklü qoyun. Qalıntüklü dəri.*

**QALIŞ** *is.* Qalma; qalmaq işi. *Əsli xanım köçdü getdi elindən; Mənim burda qalışıma nə deyim?* Aşıq Kərəm.

**QALİB** *sif.* [*ər.*] Üstün gələn (gəlmiş), qələbə çalan (çalmış). *Qalib ordu. – Fəxrəddinin qalib dəstələri şəhərə girdiyi zaman, Gəncə qadınları qalib dəstələrin başına damlardan gül səpirdilər.* M.S.Ordubadi. // İs. mənasında. *Qaliblər marşı.* – [İlyas qıza:] *Şəxsi həyat üzərində qopan gurultular, yemək və qazanc üstündəki vuruşmalar, aldadanların şadlığı, aldananların göz yaşı, haqqını müdafiə edənlərin məğlubiyyəti, qaliblərin bayram təntənələri .. məni yoran işlərdəndir.* M.S.Ordubadi. □ **Qalib gəlmək (olmaq, çıxmaq)** – 1) üstün gəlmək (olmaq, çıxmaq), qələbə çalmaq. *Məğlub olanlar qalib çıxmağa tələsənlərdir.* M.S.Ordubadi; 2) yarışda irəlidə olmaq, birinciliyi qazanmaq. *Beynəlxalq şahmat yarışlarında şahmatçılarımız qalib gəldilər.* – [Sevinc:] *Bu mübarizədə qalib çıxmaq üçün gərək ağlın iti olsun, qolun da güclü.* Z.Xəlil; 3) *məc.* Təsir etmək, zor gəlmək, əldən salmaq, üzmək. *Biz uşaqların bütün günləri bağlarda keçirdi. Ta aclıq bizə qalib gəlməyincə evlərimizə qayıtmazdıq.* S.S.Axundov.

**QALİBA** *ara söz* [*ər.*] *kit. köhn.* 1. Çox ehtimal ki, yəqin ki, zənnimcə, mənə görə. *Demirəm mən sənə şair deyilsən, var şerin; Vəzni var, qafiyə var, qaliba yox can, Yusif!* S.Ə.Şirvani.

2. B a x **qalibən**. *Ümum camaatında qaliba mütəəssib və avamlığını da mülahizə edəndə tamam məyusluq və naümidlik üz verirdi.* C.Məmmədquluzadə.

**QALİBANƏ** *zərf* [*ər.* qalib və *fars.* ...anə] Qalib sifəti ilə, qalib kimi, qaliblərə yaraşan bir tərzdə. *Qalibanə yürüş.*

**QALİBƏN** *zərf* [*ər.*] *kit. köhn.* Əksəriyyətlə, əksərən, çox zaman, çox vaxt. *Əhli-İran qalibən bisavaddırlar.* M.F.Axundzadə.

**QALİBİYYƏT** *is.* [*ər.*] Döyüşdə, müharibədə, mübarizədə, yarışda üstünlük, müvəffəqiyyət; qalib gəlmə, qələbə (*məğlubiyyət* ziddi). *Düşmən üzərində qalibiyyət. Yarışda qalibiyyət qazanmaq. – Biz səadətin qədrini bildiyimiz kimi, qalibiyyətin məğrur sevincini də dərk etmişik.* Ə.Məmmədxanlı. *Müjdə çətin yaranır, muştuluq ondan çətin; Nə yaxşı ki, məğziyəm, çətin qalibiyyətin!* X.Rza.

**QALİBİYYƏTLİ** *sif.* Həmişə qalib gələn, müzəffər; məğlubedilməz. *Qalibiyyətli türk ordusu. Qalibiyyətli xalq üsyanı.*

**QALİBLİK** *is.* Qalib gəlmə, üstün gəlmə. *Qalibliyin məğrurluğu nə don geyir; Son zərbənin nəşəsinə bürünəndə?!* M.Araz.

**QALİFÉ** [*fr. xüs. is.*-dən] Aşağısı dar, yuxarısı isə yanlardan enli hərbi şalvar. *Əksərən uzunboğaz çəkmə, qalife şalvar və cibli köynək geyərək belini qayışla bərkitmiş kişilər furqonun yan tərəfinə doluş(du)..* M.İbrahimov. *Onun boyu az uzun, şalvarı az qa-*

*life, çənəsi az yastı, bədəni arıqdır*. Qantəmir. *Şahnaz onun* [Qurbanın] *corablarını çıxarıb, qalife şalvarının balağını yuxarı çəkdi.* İ.Şıxlı.

**QALLAC** *sif. dan*. Əliaçıq, səxavətli. *Qallac adam.*

**QALLAR** *cəm* Eramızdan qabaq IV–I əsrlərdə indiki Fransa və Belçika ərazisinin bir hissəsini tutmuş qədim kelt tayfaları. *Qalların üsyanı*. *– Kim deyir ki, bu qalalar* [Qız qalası]; *Yalnız elə qallar üçün; Qaldırılan bir qaladır?* B.Vahabzadə.

**QALLI** *sif.* Qalmaqal salan, qalmaqalçı. *Çoxlarını məhv elədi bu qovğalı, qallı dünya; Sultanlara qalmadı, yox, Nəsimiyə qaldı dünya.* X.Rza. // Şıltaq. *Ziba nimtənəli, tikmə köynəkli; Gözləri qəmzəli, qallı sənəm, gəl*. Xəstə Qasım.

**QALLİSÍZM** [*fr.*] *dilç*. Fransız dilindən alınma söz, ya ifadə; fransız dilinə xas olan cümlə.

**QALLÓN** [*ing.*] İngiltərədə, ABŞ-da və başqa ölkələrdə maye və səpələnən cisimlər üçün həcm ölçüsü vahidi (4,5 litrə bərabərdir).

**QALMA** "Qalmaq"dan *f.is.*

**QALMAQ** *f.* 1. Olduğu yerdə və halda durmaq, yerini dəyişməmək, yerindən getməmək. *Hamı getdi, o qaldı. Qışda kənddə qalmaq. – Evdə ancaq Sona ilə Bahadır qaldı.* N.Nərimanov. *Bu axşam student evdə qalaraq, atasına məktub yazmaqla məşğul idi.* Çəmənzəminli. // Yuxarı sinfə keçməmək. *İkinci sinifdə qalmaq.*

2. Var olmaq, mövcud olmaq, davam etmək. *Onun gözəlliyindən ancaq iki gözü qalmışdır. Ürəyində heç bir hiss qalmamışdır.*

3. Sağ olmaq, həyatda olmaq, yaşamaq. *Onun indi bircə qızı qalmışdır. – Şirin güftarından ayrı lalam mən; Ümid yoxdur gələn ilə qalam mən*. Q.Zakir. // İnkar şəklində: **qalmamaq** – ölmək, yaşamamaq, həyatda olmamaq, sağ olmamaq. *Övladı qalmamaq. Onlardan heç kəs qalmamışdır*.

4. İşləndikdən, sərf edildikdən, xərcləndikdən sonra müəyyən miqdar mövcud olmaq. *On kilo düyüdən bir kilo qalmışdır. Cibimdə bir manat pulum qalıbdır.* // Bir ədədi bir ədəddən çıxdıqdan sonra hasil olmaq. *Beşdən üç çıxanda iki qalır*.

5. Təxir edilmək, sonraya buraxılmaq, başqa vaxta keçirilmək. *İclas sabaha qaldı.* // Dayandırılmaq, əl çəkilmək, buraxılmaq, tərk edilmək, vaz keçilmək. *O iş qaldı. Kitabın nəşri hələlik qaldı.*

6. Bir yerdə unudulub buraxılmaq, yaddan çıxarılmaq. *Portfelim maşında qaldı. Gözlüyüm evdə qalıbdır.*

7. İrs yetişmək, irsən çatmaq. *Atasından ona xeyli şey qaldı. – Dörd otaqdan ibarət ağzınacan dolu, topdağıtmaz ev-eşik təkcə ona* [Ağcaya] *qalmışdı*. Mir Cəlal.

8. Məhrum olmaq, əlindən çıxmaq. *Qəpiksiz qalmaq. Yuxusuz qalmaq. Paltosuz qalmaq. İşsiz qalmaq. – Seyr üçün camalını əlimdə fürsət varkən; Əfsus ki, indiyədək qaldım ziyarətindən*. Ə.Cavad.

9. Edə bilməmək, başa çatdıra bilməmək, nail ola bilməmək, davam etdirə bilməmək, gedə bilməmək, iştirak edə bilməmək. *Dərsdən qalmaq*. *– Qara qoçun kəlləsinin zərbəsi ilə Bəxtiyar onbasının ağrısından iki gün işdən və fəhləlikdən qaldı.* S.Hüseyn. // Gecikmək, çatışa bilməmək, yetişə bilməmək, gecikərək yerində qalmaq. *Qatardan qalmaq*.

10. Gələndən sonra müvəqqəti olaraq bir yerdə yerləşmək, qərar tapmaq, bir yerə düşmək; qonaq olmaq. *Bu gecə harada qalmışdınız? Qonaqlar dünən bizdə qalmışdılar.*

11. Aid olmaq, dəxli olmaq, üzərinə düşmək. *Onun dərdini çəkmək sənəmi qalıbdır?*

12. İlişmək, ilişib qalmaq, girib çıxmamaq. *Boğazında sümük qalmaq. Güllə əzələsində qalıbdır*.

13. Bir hala düşmək, bir vəziyyət içərisinə düşmək. *Pis vəziyyətdə qalmaq. Ayaq üstə qalmaq. O, üç yaşında atasız qaldı. Yuxusuz qalmaq*. – [Xanımnaz:] *Qorxuram .. qulluqdan çıxardarlar səni, yenə qalarıq əvvəlki kimi elə belə*. C.Cabbarlı.

14. Mühafizə etmək, davam etmək, əl çəkməmək, saxlamaq. *Öz fikrində qalmaq. Tutduğu mövqeyində qalmaq.*

15. Yubanmaq, durmaq, bir yerdə ilişib qalmaq, gəlib çıxmamaq. *Bizim yoldaşlar harada qaldı? Yarı yolda qalmaq. Bu vaxta kimi harada qalmısan?*

16. Vaxt, zaman haqqında. *Saat beşə üç dəqiqə qalıbdır. Ayın axırına iki gün qalıbdır.*

*Onun ömrünə az qalıbdır. – Axşama bir saat qalmış* [Cəfərqulu] *Fərhad bəyin qapısına yetişdi*. Qantəmir. // Hələ çatmamaq, yetişməmək. *Lakin hələ Tükəzban xalanın təklifinin* [iclasda] *qəbul olmaq vaxtına qalırdı*. B.Talıblı.

17. İnkar şəklində: **qalmamaq** – 1) hamısı sərf olunmaq, işlənib qurtarmaq. *Dağ başın duman almır; Yar yarın dərdə salmır; Dövlət şirin olsa da; Axırda heç kəsə qalmır.* (Bayatı). [Qurban:] *Səhər qazandığın axşama qalmır.* Ə.Haqverdiyev; 2) qırılıb qurtarmaq, məhv olub (edilib) qurtarmaq; 3) kifayətlənməmək. [Səlimi:] *Oğlan, xarici kapital yalnız bizim torpağın sərvətini talan etməklə qalmır. O, şəxsi mənfəət üçün hər şeyə hazır olan ərbablarımızdan, aclıq və səfalətin qucağına atdığı yüzlərlə biçarələrdən casuslar, satqınlar yetirir.* M.İbrahimov; 4) geri qalmamaq, bərabər olmaq. *Dəcəllikdə yoldaşından qalmaz.* – [Mahmud:] *Mənim barmaqlarım kobudluqda, bərklikdə oymaqdan qalmaz!* Ə.Əbülhəsən; 5) hərəkətində, işində, adətində davam etmək, arasını kəsməmək, əl çəkməmək. *Kefindən qalmamaq. İşindən qalmamaq. – Guya Zeynal vəzifəsinə çox soyuq baxır, dəfələrlə özünə xatırladılmasına baxmayaraq, səhlənkarlıqdan qalmırmış*. S.Hüseyn.

18. **Qalmamışam, qalmamışıq** şəklində – ehtiyacım(ız) yoxdur, bizə lazım deyil. [Səfər:] *Yüzbaşı, – dedi, – sənin buğdana qalmamışıq, bir az özünü yığışdır.* Çəmənzəminli.

19. Bir sıra isimlərin yanına gətirilərək, ismin göstərdiyi mənada mürəkkəb feil, yaxud müxtəlif ifadələr düzəldilir; məs.: avara qalmaq, sağ qalmaq, gözü qalmaq, heyran qalmaq.

◊ **Əslinə qalanda** – əslində, həqiqətdə, doğrusuna gəldikdə. *Əslinə qalanda bu vəhşilərin* [qoçuların] *həyatı qazamatda da pis keçmirdi*. H.Sarabski. **O ki qaldı..., qaldı ki...** – ...gəlincə, ...gəldikdə. [Fərəcullah:] *Ancaq o ki qaldı mənə, mən razıyam. Bir qız .. bir oğlanındır, gülüm!* H.Sarabski. *Xeyr, xeyr, mən onun* [tələbəmin] *adını sizə deyə bilmərəm. Qaldı ki, onun zahiri görünüşü, xasiyyəti, qabiliyyəti haqqında danışmaq, bu başqa məsələdir.* Qantəmir.

**QALMAQAL** *is.* Səs-küy, dava, dava-dalaş. *Qalmaqal salmaq* (*etmək*). – *Hər zaman ki, səndən umdum şəfəqqət; Bir dava başladın, qalmaqal etdin.* M.P.Vaqif. *Emalatxanada böyük bir qalmaqal çıxdı.* M.S.Ordubadi. *Qapı ağzında oturan köhnə cahıl işin şuluq olduğunu və qalmaqal olacağını görüb, mütrübün oyununu saxladı*. H.Sarabski. // Dedi-qodu, söz-sov, cəncəl. [Şölə xanım:] *Onun qalmaqalının qorxusundan hərgiz cürət edib bura ayaq basa bilməz*. M.F.Axundzadə. *..Getdin Məhəmmədhəsən əminin eşşəyini gətdin, bizi qoydun qalmaqalda?* C.Məmmədquluzadə.

**QALMAQALÇI** *is.* Daim qalmaqal düzəldən adam. *..Bu müstəbid təbiətli adam eyni zamanda bir küçə qalmaqalçısı qədər ağzısöyüşlü, tərbiyəsiz idi*. M.İbrahimov.

**QALMAQALÇILIQ** *is.* Daim qalmaqal salma xasiyyəti; davakarlıq.

**QALMAQALLI** *sif.* Davalı, dava-dalaşlı, cəncəl. *Qalmaqallı iş*.

**QALOŞ** [*rus.*] *is.* Ayağı rütubət və palçıqdan qorumaq üçün adətən çəkmə, tufli və s. üstündən geyilən rezin ayaqqabı. *Örtülü qaloş. Uşaq qaloşu. – Paltoları və qaloşları çıxarıb Həsən ağaya tapşırdıq.* M.S.Ordubadi. *Cümlə dəyişdirmisən kürkünü, paltarını; Çəkmə, qaloş geymisən, pozmusan ətvarını..* M.Ə.Sabir.

**QALPAQ** *is.* 1. Mahuddan, keçədən, bezdən, yaxud dəmirdən və s.-dən qayrılan baş örtüsü – papaq. *Aşpaz qalpağı. Qaynaqçı qalpağı.* – [Balacayev] *əyninə ağ xalat geymiş, başına ağ qalpaq qoymuş, gözlərinə ağ dəmir saplı eynək ilişdirmişdi*. S.Rəhimov.

2. Müxtəlif şeylərin üstünə qoymaq üçün qapaq, örtü. *Qoruyucu qalpaq*.

**QALPAQCIQ** *kiç*. Kiçik qalpaq.

**QALPAQLI** *sif.* Başına qalpaq qoymuş. *Kərim baba iri qalpaqlı başını, uzun çal saqqalını oynadaraq, bir daha diqqətlə buludu süzdükdən sonra: – Buna oynaq bulud deyərlər*. A.Şaiq. *Hər pillədə əlvan geyimli, xoruz qalpaqlı uzunsaqqallı bir qoca oturmuşdu.* Çəmənzəminli. // Üstündə örtüsü, qapağı olan.

**QÁLSTUK** [*alm.*] Köynəyin üstündən boyuna bağlanan enli lent; boyunbağı. *Qalstuk bağlamaq. İpək qalstuk. – Sənubər ərinin*

*pencək və qalstukunu alıb asaraq, stolun üzərinə qoyulmuş yeməklərin üstünü açdı.* İ.Əfəndiyev.

**QALSTUKLU** *sif.* Boynuna qalstuk bağlamış. *Boynu qalstuklu bir qarayağız adam ani sürətlə maşına baxıb, yenə furqondakı adama döndü.* M.İbrahimov. *Məktəb həyati yüzlərlə əli portfelli, boğazı qalstuklu oğlan-qızla dolmuşdu.* Mir Cəlal.

**QALTAQ** *is.* Yəhərin ağacdan olan hissəsi. // Arabaya qoşulan heyvanın belinə qoyulan qoşqu aləti.

**QALTAQÇI** *is.* Qaltaq qayıran usta.

**QALTAQLAMA** "Qaltaqlamaq"dan *f.is.*

**QALTAQLAMAQ** *f.* Heyvanın dalına qaltaq qoymaq, qaltaq bağlamaq.

**QALTAQLANMA** "Qaltaqlanmaq"dan *f.is.*

**QALTAQLANMAQ** *məch.* Heyvanın dalına qaltaq qoyulmaq, qaltaq bağlanmaq.

**QALÜ BƏLA** *is.* [*ər.* qal və *fars.* bəla] Adətən "qalü bəladan" şəklində – lap əvvəldən, lap əzəldən, köhnə zamandan. *Qalü bəladan belə olmuşdur. – Gözəl yaranıbsan qalü bəladan; Yanağın göyçəkdir güldən, lalədən.* Aşıq Ələsgər.

**QALÜ QİL** [*ər.*] b a x **qilü qal**.

**QALVANÍK** *sif. fiz.* Qalvanizasiyaya aid olan. *Qalvanik element. Qalvanik cərəyan.*

**QALVANİZÁSİYA** [italyan fiziki Qalvaninin adından] Tibbi və ya başqa məqsədlər üçün sabit elektrik cərəyanı tətbiqi.

**QALVANÓMETR** [*ital. xüs.* Qalvani və *yun.* metr] *elektr.* Zəif elektrik cərəyanını ölçmək üçün cihaz. *Güzgülü qalvanometr. Mütəhərrik sarğaclı qalvanometr. Sabit və dəyişən cərəyan qalvanometrləri var.*

**QALVANOMETRÍK** *sif.* Qalvanometrə aid olan.

**QALVANOSKÓP** [*xar.*] Elektrik dövrəsində sabit cərəyanın varlığını və onun istiqamətini təyin etmək üçün cihaz.

**QAMAK** *is.* Torlu asma yataq.

**QAMARLAMA** "Qamarlamaq"dan *f.is.*

**QAMARLAMAQ** *f.* 1. Bir şeyi tez və qaba surətdə qapıb götürmək; əlləri ilə bir şeydən bərk-bərk yapışmaq, tutub saxlamaq. *Stolların dalında oturanlara yaxşı baxın, haman stəkanları qamarlayan barmaqları da nəzərdən keçirin.* M.S.Ordubadi.

2. Tutmaq, yaxalamaq. [Mehralı:] *Müxtəsər, bankdan bizim çeklərlə pul alanda hərifləri qamarlayıblar.* S.Rəhman.

**QAMARLANMA** "Qamarlanmaq"dan *f.is.*

**QAMARLANMAQ** *məch.* 1. Tez və qaba surətdə qapılıb götürülmək.

2. Tutulmaq, yaxalanmaq.

**QAMARLAŞDIRMA** "Qamarlaşdırmaq"dan *f.is.*

**QAMARLAŞDIRMAQ** *qarş.* Hərə bir tərəfdən qamarlamaq.

**QAMAŞDIRMA** "Qamaşdırmaq"dan *f.is.*

**QAMAŞDIRMAQ** *f.* 1. Dişləri kəsməz və uyuşmuş bir hala salmaq (turş şey haqqında). *Göyəm (alça) dişlərimi qamaşdırdı.*

2. Gözləri görməz bir hala salmaq (güclü işıq, parıltı və s. təsiri ilə). *İşıq gözlərimi qamaşdırdı. Qar gözlərimi qamaşdırır.* – [Hacı Murad:] *Adamların şəfəqi gözlərimi qamaşdırır.* S.S.Axundov. *Yaz günəşinin işıqları Rəşidin qara iri gözlərini qamaşdırdı.* M.İbrahimov.

**QAMAŞIQ** *sif.* Qamaşmış halda olan (göz və diş haqqında).

**QAMAŞMA** "Qamaşmaq"dan *f.is.*

**QAMAŞMAQ** *f.* 1. Turş bir şey dişləməkdən, yaxud dişə dəyməkdən kəsməz və uyuşmuş bir hala gəlmək. *Alçadan dişlərim qamaşdı.*

2. Parlaq bir şeyə və ya çox güclü işığa baxmaqdan, yaxud qaranlıqdan işığa çıxarkən qaralıb görməz hala düşmək. *Günəşə baxdım, gözüm qamaşdı.* // Məc. mənada. *Siyah vəsmə zivər çəkibdir qaşa; Onu görən gözlər istər qamaşa.* M.P.Vaqif. *Zöhrə! Sənin camalının şövqündən; Gün tutular, göz qamaşar, ay gəlməz.* (Qoşma).

**QAMBÚZİYA** [*isp.*] Qızdırma ağcaqanadlarını tələf etmək məqsədi ilə şirin su gölməçələrinə buraxılan çox kiçik balıq cinsi. *Orta Asiyada ağcaqanad sürfələrinə qarşı mübarizə üçün onların olduğu gölməçələrə tropik ölkələrdə yaşayıb diri bala doğan qambuziya balığı buraxırlar.* "Darvinizm əsasları".

**QAMÇI** *is.* Heyvanları vurmaq, yaxud hürkütmək üçün bir ağacın ucuna bağlanmış ip, dəri və s.; şallaq, qırmanc. *Arabaçı atları saxladı, düşdü yerə. Sonra qamçını arabanın içinə tullayıb getdi.* C.Məmmədquluzadə.

*Bu zorbalıqda ayı mənim qamçımın qorxusundan hələ bir oyun çıxarır, amma bu balacalıqda qızın əlində aciz qalmışam.* S.S.Axundov. // *məc.* Zərbə mənasında.

**QAMÇILAMA** "Qamçılamaq"dan *f.is.*

**QAMÇILAMAQ** *f.* 1. Qamçı ilə vurmaq. *Atları qamçılamaq. – Heyvanı rahat qoymayıb qamçıladım.* S.S.Axundov. *Şirəli çiynindəki tüfəngi doldurdu, atı bərk qamçıladı.* M.Hüseyn. // *məc.* Döyəcləmək, vurmaq. *Başımızın üstündə yağmur alaçığın keçələrini gum-gum qamçılayırdı.* A.Şaiq. *Artıq yağış başlamışdı. Qorxunc bir gurultu ilə pəncərəni qamçılayır, suyu içəri sıçradırdı.* Çəmənzəminli.

2. *məc.* Bərk tənqid etmək, ifşa etmək; eyib və nöqsanlarını açıb göstərərək tənqid etmək. *Yazıçı öz əsərində köhnə həyatın mənfi cəhətlərini qamçılayır.*

**QAMÇILANMA** "Qamçılanmaq"dan *f.is.*

**QAMÇILANMAQ** *məch.* 1. Qamçı ilə vurulmaq, döyülmək.

2. *məc.* Bərk tənqid olunmaq, ifşa olunmaq. *Bu əsərdə olduğu kimi cahil şeyxlərin təəssüb və şarlatanlığı heç bir zaman qamçılanmamış və qamçılana bilməzdi də.* N.Vəzirov.

**QAMÇILATMAQ** *icb.* Qamçı ilə döydürmək.

**QAMÇILILAR** *cəm zool.* Təkhüceyrəli ibtidai heyvanlar; əsasən şirin sularda yaşayan və qamçıya oxşar hərəkət orqanı olan mikroskopik heyvanlar.

**QAMƏT** *is.* [*ər.*] 1. Boy, boy-buxun, qədd. *Der idim qamətinə sərv, vəli özgə imiş.* Füzuli. *Qamətin tək heç bir qamət biçilməz.* M.P.Vaqif. *Sərvi xar etdi, əcəb, bu qamətirənayə bax.* Heyran xanım. *Fəda o qamətinə kim, qəza nə xoş çəkmiş.* X.Natəvan.

2. Bel. *Bir əllə də qılınc vurmaq mənim köhnə adətimdir! Buna şahid qocalsam da, bükülməyən qamətimdir!* S.Vurğun. ◻ **Qaməti bükülmək (əyilmək)** – beli əyilmək (bəzən qocalmaq mənasında). *Dərd yükünün ağırlığı altında əyilməyə başlayan qamətini, ayaqları ağır-ağır qapıya sarı çəkdi.* Ə.Əbülhəsən.

**QAMƏTLİ** *sif.* Boylu-buxunlu, təndürüst, sərrast bədəni olan. *Rəşid .. sadə geyimli, qamətli bir qızın ardınca düşüb heç yana baxmadan tələsik gedir, özünü ona yetirməyə çalışırdı.* M.Hüseyn.

**QAMIŞ** *is.* 1. Sulaq yerlərdə bitən uzun, içiboş gövdəli, buğumlu bir bitki; qarğı. *Görürsən on üç yaşında bir uşaq nə qədər ki, qamışdan at qayırıb, minib küçələri o tərəf-bu tərəf kişnəyə-kişnəyə çapır, sağ və salamatdır.* C.Məmmədquluzadə. *Orada-burada göllənmiş suların içində adamboyu hündürlüyündə göy qamışlar ucalırdı.* M.Hüseyn. // Şəkər qamışı (şirəsindən şəkər hazırlanan qamış). *Şəkər qamışından qayrılmış qəndi birinci dəfə Hindistandan tacirlər Avropaya gətirdikdə Qərb əhalisinin heyrətinə mucib olmuşdur.* A.Səhhət. // Qamışdan qayrılmış. *Qamış qələm. Qamış çəpər. – Biz o tarixi qamış qələmlərlə deyil, iti qılınclarımızla yazmalıyıq.* M.S.Ordubadi. *Seyid qamış qələmi cızıqlı kağız üzərində cırıldadaraq kəşidə xətlə Tahirzadəyə şəhadətnamə yazdı.* Mir Cəlal.

2. Qamış kimi içi boş və uzunca şey.

**QAMIŞQUŞU** *is. zool.* Əsasən qamışlıq yerlərdə yaşayan kiçik bir quş.

**QAMIŞLIQ** *is.* Çoxlu qamış bitən yer. [Heydər bəy:] *..Gərək qıraqdan uzaqlaşaq, qamışlıqda gizlənək.* M.F.Axundzadə. *Qamışlıqda quruldayan qurbağalar tez-tez səslərini kəsib şappıltı ilə suya atılırdılar.* İ.Şıxlı.

**QAMQALAQ** *is.* Xarrat işləri zamanı yerə tökülən nazik taxta – talaşa. *..Sarı əlinə düşən çör-çöpü, qamqalağı, çır-çırpını samovara atır.* S.Rəhimov. *..Qovrulacaq, burulacaq dilim-dilim; Hayandasa qor düşəcək qamqalağa.* M.Araz.

**QAMQALDAQ** *is. dan.* Nizamsız bir halda boşaldılıb, bir-birinin üzərinə tökülmüş şeylər.

**QÁMMA** [yunan əlifbasının 3-cü hərfinin adı] 1. *mus.* Bir yaxud bir neçə oktava daxilində qalxan, yaxud enən səslərin ardıcıl sırası. *Avropa musiqisində 24 qamma vardır, bunun əvəzində bizdə 120 qamma vardır.* Ü.Hacıbəyov.

2. *məc.* Hər hansı bir yekcins, lakin bir-birindən fərqli olan şeylərin, hadisələrin ardıcıl sırası; bu və ya digər hadisələrin ardıcıl surətdə dəyişməsi. *Boyaların qamması.*

◊ **Qamma şüalar** *fiz.* – radioaktiv maddələrin buraxdığı üç növ şüalardan biri.

**QAMU** "Hamı" sözünün qədimi forması. *Qamu bimarinə canan dəvayi-dərd edər ehsan; Neçün qılmaz mənə dərman, məni bimar sanmazmı?* Füzuli. *Cahanda qulların çoxdur, Nəsimi qamudan bədtər*. Nəsimi.

**QAMUS** *is.* [*ər.* əsil mənası "dəniz, dərya"] Böyük lüğət kitabı; ensiklopediya.

**QAN** *is.* 1. Orqanizmin damarlarında dövr edib, onun bütün hüceyrələrinin qidalanmasını və maddələrin mübadiləsini təmin edən qırmızı maye. *Sadıq kişi əllərinin qanını arxda yuyub üz qoydu həyətdən çıxmağa*. C.Məmmədquluzadə. *..Çox qan itirməsinə baxmayaraq, bədənin möhkəmliyi və cavanlığı Tapdığın sağalmasına kömək etmişdi.* Ə.Əbülhəsən. ◻ **Qan damarı** *anat.* – insan və heyvan bədənində qanın axdığı damar. *Qoyunun mədəsində toxumdan bir kiçik qurd çıxır ki, bağırsağı deşib qan damarına girib qan ilə belə gedib qoyunun beyninə yetişib, orada barama qurdu kimi özünə ətdən barama qayırır.* "Əkinçi". *Ürək deyilən möcüzəsinin dərinlərində; qırıldı bir kiçik qan damarı.* R.Rza. **Qan dövranı** *fiziol.* – bədəndə qanın damarlarda dövr etməsi. **Qan getmək** – çox qan axmaq, çox qan axıtmaq, çox qan itirmək. *Bu dağdan bir can getdi; Ürəyindən qan getdi; Qız nə cür ağlamasın; Sevdiyi oğlan getdi.* (Bayatı). **Qan təzyiqi** *tib.* – damarlarda qanın təzyiqi. *İnfarkt, qan təzyiqi!.. İki xəstəlik; Əsrin gərginliyi, əsrin zədəsi!* B.Vahabzadə.

2. *məc.* Qan qohumluğu mənasında. *Səmədin qorxusu qaçdı və öz-özünə: – Yox-a, özümünküdür?.. Qandır, zarafat deyil, – deyə bacısı oğlundan lap arxayın oldu*. B.Talıblı.

3. *məc.* Qətl, adam öldürmə. *Burada, deyəsən, qan var*.

4. *məc.* Düşmənlik, qanlı ədavət. *Aralarında qan var.* – [Eyvaz:] *Bu qanı tarix yuya bilməyəcəkdir. Açın gözlərinizi, qardaşlar, aldanmayın!* C.Cabbarlı.

5. Öldürülən adamın intiqamı, qisası. *Qanını tələb etmək. – Atamın qanını unutmaq üçün mən gərək bişərəf və binamus bir adam olam.* M.İbrahimov. ◻ **Qan düşməni** – barışmaz, qəddar düşmən. *Hər nə isə mənimdi bu; Əsrlik qan düşməninə; Deyə bilmir son sözünü; Amma qırır öz-özünü, utanıram.* B.Vahabzadə. **Qan düşmən(çi)liyi** – köhnə məişətdə: öldürülmüş yaxın qohumun intiqamını almaq adəti. *İnqilabdan əvvəl keçmiş zəhmətkeş kütlələrinə çoxlu zərər yetirən vəhşi adətlərdən biri də qan düşmənçiliyi idi.* S.S.Axundov.

6. *məc.* Dava, müharibə mənasında. *Qan olmasın deyə dünya xalqları arasında sülh yaradılmalıdır*.

7. *məc.* Təbiət, fitrət. ◻ **Qanında olmaq** – təbiətində olmaq, fitrətində olmaq.

8. *məc. dan*. Təəssüb, qeyrətkeşlik mənasında. *Onda heç qan yoxdur*.

◊ **Qan ağlamaq** – 1) çox mütəəssir olmaq, qanlı göz yaşı tökmək, yasa batmaq. *Səndən ayrı ol qədər qan ağladım ki, dəmbədəm; Yaşa batıb islanıb səbrü qərarın kağızı.* M.P.Vaqif. *Bülbül gül üzündə xarı görəndə; Qan ağlar, rüxsarı yaşı dayanmaz.* Aşıq Ələsgər. [İsmayıl:] *Yox, ölməyibdir, amma bir günə düşübdür ki, görsən qan ağlarsan.* Ə.Haqverdiyev; 2) cana gəlmək, təngə gəlmək, zara gəlmək, çox incimək, dad çəkmək. **Qan ağlatmaq** – cana gətirmək, təngə gətirmək, çox incitmək, zülm etmək. *Qan ağlatdın ürəyimi, üstəlik də tənə vurma; Sındırdığın bu şüşədən qan axar al şərab kimi.* Şəhriyar. **Qan axıtmaq** – 1) müharibə etmək; müharibə qızışdırmaq; 2) adamların ölməsinə, qırılmasına səbəb olmaq. *Qazan dağında, Acıbulaqda, Qarasuçuda, Samıxda, Zincirlidə olan vuruşmalarda Alının dəstəsi yüzlərlə adam qırmışdı, sel kimi qan axıtmışdı.* "Aşıq Ələsgər". **Qan axmaq** *məc.* – dava və qırğın düşmək. *Öz yurdunu şum eləmək; Qan axıtmaq, sonra, sonra; Su axtarmaq – qan yumağa?!* M.Araz; **Qan aldırmaq** – xalq arasında müalicə məqsədi ilə damardan qan çıxartdırmaq. *Mənim əmim Kərbəlayı İmam Qulu .. ildə otuz iki dəfə dəllək usta Mədədi çağırıb qan aldırar*. C.Məmmədquluzadə. **Qan almaq** – 1) müalicə məqsədi ilə damardan qan çıxarmaq. [İkinci azarlı:] *..Hacı əmi, bu baş ağrısı məni həlak eləyibdir; .. gedirəm usta Cəfərin yanına, deyir: – Qanın çoxalıb, gərək səndən qan alam.* C.Məmmədquluzadə. *At çərləmişdi. Bu saatda atdan qan almaq lazımdır*. Ə.Vəliyev; 2) *məc.* intiqam almaq. *Mahmudun qanını bəylərdən almasam, Xocahandan*

*getməyəcəyəm.* "Qaçaq Nəbi". **Qan aparmaq** – yaradan çox qan axmaq nəticəsində üzülüb özündən getmək. *Ey kamanqaşlı, məni yarələdi qəmzən oxu; Zülfünü bas yarama, qoyma, məni qan aparır*. S.Ə.Şirvani. *Deyir:* "*Yoldaş, qorxma məndən, qorxma, məni qan aparmaz*". S.Vurğun. **Qan bahası** – köhnə məişətdə: öldürülən bir adamın əvəzində öldürəndən və ya onun qohumlarından alınan pul və s.; qan əvəzi, diyə. *Gəl, ey aşiq, şəhid ol eşq içində; Ki, həqdir ol şəhidin qan bəhası*. Nəsimi. *Hakimlərin gəlir mənbələrindən birisi də ərəblər vaxtından qalan diyə, yəni qan bahası məsələsidir. Adam öldürənlərə cəza verilmir, çünki qatillər qanın bahasını verib günahlarını təmizləyirlər.* M.S.Ordubadi. **Qan bahasına** – çox böyük insan tələfatı hesabına, böyük qurbanlar verərək. *Görəcəksiniz! Almanlar qan bahasına tutduqları şəhərləri qoyub Berlinə daban almasalar, mənə nə deyirsiniz, deyin!* Mir Cəlal. **Qan başına vurmaq** – son dərəcə qəzəblənmək, özündən çıxmaq, hiddətdən özünü bilməmək. *Nəbi Həcərin tutulmasını Kirə dağında eşitdi. Həmin saat qan sıçradı onun beyninə*. "Qaçaq Nəbi". *Məktubu oxuduqda qanım başıma vurdu*. M.S.Ordubadi. **Qan beyninə vurmaq (sıçramaq)** – b a x **qan başına vurmaq**. [İbad:] *Doğrusunu deyin. ..Qan beynimə vuranda; it kimi doğraram onu*. C.Cabbarlı. **Qan çanağı** – 1) qan tökmək istəyən, qan-qan deyən, davakar, fitnəkar, araqarışdıran adam haqqında. [Ömər Koxa:] *Görəsən, Həsən ağa namərdlik etməyib ki? Bilirəm Alqazax uşağı qan çanağıdır, nahaq yerə onlara* "*Dəli Alqazaxlılar*" *demirlər.* İ.Şıxlı; 2) *məc.* şərab piyaləsi mənasında. *Əksi-ləbin səadətini bulmasaydı mey; Meyl etməz idi hiç kəs ol qan çanağına.* Q.Zakir. **Qan çanağına dönmək** – qəzəbin, hirsin şiddətindən, yaxud ağlamaqdan, xəstəlikdən və ya yuxusuzluqdan gözləri bərk qızarmaq, qanla dolmaq, qıpqırmızı olmaq. [Səkinə xanım:] *Bir güzgüyə bax, gör, gözlərin acıqdan qan çanağına dönübdür.* M.F.Axundzadə. *Xan hiddətindən dodaqlarını gəmirir. Hirsindən gözləri qan çanağına döndüsə də, Vaqifin dediklərinə qarşı bir söz tapa bilmədi*. Çəmənzəminli. **Qan çəkmək** – 1) qohumluq əlaqəsini büruzə vermək, yaxınlaşmaq; 2) qızarmaq. *Gözləri qan çəkmək.* **Qan düşmək** – dava düşmək, ədavət düşmək. *Könlüm quşunu seyd eylədi qəmzeyi-çeşmin; Qorxum budu, qanlar düşə ortaq arasında.* Q.Zakir. **Qan eləmək (etmək)** – 1) adam öldürmək. *Aşıqlar bağrını şan-şan eylərsən; Hər qıya baxanda yüz qan eylərsən.* Q.Zakir. *Çoxdu günahım, onu əfv et mana! Qan eləyib qapına gəldim dəxil*. S.Ə.Şirvani; 2) *məc.* şiddət eləmək, çoxlu ziyan vermək, tələfata, fəlakətə, bədbəxtliyə səbəb olmaq. *Bu çay coşub daşanda nə qanlar eləməmişdi. İndi qış onu gücdən salmışdı.* Çəmənzəminli. **Qan görmək** – aybaşı olmaq. **Qan içdirmək** – b a x **qan uddurmaq**. *Aşıq Humay indi bu saat özündən çıxıb, yoryoxsulun başı üstündə qamçı oynadan mülkədar balalarına qan içdirirdi. Qaçaq Nəbidən deyir, Həcəri tərifləyirdi.* Ə.Vəliyev. **Qan içmək** – zülm etmək, qəddarlıq etmək, insan qanına susamaq. *Tarix cəllad qan içməkdən yorulmaz; Tərpənişsiz qara zəncir qırılmaz*. C.Cabbarlı. // *məc.* İstismar etmək, qanını sormaq. *Deyirdi ki, gərək bəyləri kənddən çıxarasınız. Bunlar sizin qanınızı içirlər*. B.Talıblı. **Qan iddiası** – qisas istəmə, intiqam tələb etmə. *Qazan deyir: Oğul, min kafir öldürsən də, kimsə səndən qan iddiasında olmaz.* "Kitabi-Dədə Qorqud". **Qan istəmək** – 1) qan bahası iddia etmək, diyə tələb etmək. *Gül kimi bir dəfə öpməklə qızarmış yanağın; Demə, gəl mən də öpüm ki, qana qan istəyirəm.* Ə.Vahid; 2) b a x **qan-qan demək**. **Qan iyi gəlmək** – qan tökməyə, adam öldürməyə hazır olan adam haqqında. *..Dönün, qayıdın, balam! Bunlardan qan iyisi gəlir!* M.F.Axundzadə. **Qan-qan demək** – qana susamaq, meydan oxumaq, heç bir səbəb olmadan döyüşməyə, vuruşmağa, qan tökməyə bəhanə axtarmaq. *İndi qan-qan deyir insanları iranlıların! Dərhəqiqət pis imiş qanları iranlıların!* M.Ə.Sabir. **Qan qaraltmaq** – acıqlandırmaq, dilxor etmək, pərt etmək, əsəbiləşdirmək. *Ucuz söz qan qaraldar ki, küsərsən dostla sirdaşdan.* S.Vurğun. [Qaçay:] *Canəli dayı, ay Canəli dayı, sənə nə oldu, qanın niyə qaraldı?* İ.Məlikzadə. **Qan qardaşı** – birgə mübarizədə axıdılan qan nəticəsində bir-birinə yaxın olan adam haqqında. *Qan qar-*

*daşım, nəhayət ver artıq yasına; Azadlığı alacaqsan qan bahasına.* S.Rüstəm. *Bizlər ki, lap bir dil, bir qan qardaşıq; Qardaş qalsın, insanlarıq, yoldaşıq..* Şəhriyar. **Qan qaynamaq** – canlanmaq, dirçəlmək, cuşa gəlmək. *Bu sözlərdən sonra Fəxrəddinin damarlarında qan qaynamağa və beyni alovlanmağa başladı..* M.S.Ordubadi. **Qan qohumluğu** – həm ata, həm ana tərəfdən olan qohumluq. **Qan qoxusu gəlmək** – 1) dava, müharibə ehtimalı olmaq, müharibə gözlənmək; 2) dava istəmək, dava üçün bəhanə aramaq. *Sənin sözündən qan qoxusu gəlir.* C.Məmmədquluzadə. *Dadaşın qardaşı çıxmış özündən; Gəlir qan qoxusu hər bir sözündən.* M.Müşfiq. **Qan qusdurmaq** – çox incitmək, əzab və əziyyət çəkdirmək, başa bəla kəsilmək. [Ayrım qızı:] *O qapı, bu qapıda veyl-veyl sürünməkdən başqa* [Kərim babanın] *əlindən bir iş gəlməzdi; evə gəldikdə bizə qan qusdurardı.* A.Şaiq. **Qan qusmaq** – 1) vərəm azarına tutulmaq; 2) *məc.* olmazın əzab, əziyyət, sıxıntı çəkmək. [Zinyət xanım:] *Doğru deyiblər ki, hər bir halda dövlət başa bir bəla imiş.* "*Neylərəm qızıl teşti, içinə qan qusam*" – *doğru söz imiş.* N.Vəzirov. **Qan ocağı** – fitnə-fəsad mənbəyi, cinayət yuvası. [Aqil:] *Məni qan ocağı adlandırdılar, kənddən qovdular.* S.Rəhimov. **Qan olmaq** – 1) qan tökülmək, adam öldürülmək. [Tellinin anası:] *Tanrının qüdrətinə şükür, ağaclarda meyvə qalmadı, görəsən yenə harda nahaq qan olub ki, balasını çəkirik.* Çəmənzəminli; 2) *məc.* qiyamət qopmaq, məhşər qopmaq, gurultu qopmaq, dava düşmək. **Qan salmaq** – fitnə salmaq, fəsad törətmək, dava salmaq, vuruşdurmaq. [Salatın:] *Qurbanın olum, ay qağa, evimizə qan salma. Amanın bir günüdü, əlini qana bulama!* İ.Şıxlı. **Qan səpilmək** *məc.* – qızarmaq, allaşmaq. *Nahardan sonra təkrar bağa çıxmışdı. Artıq günəş batır, qüruba qan səpilirdi.* Çəmənzəminli. **Qan su yerinə axmaq (yerimək**) – çox qan tökülmək, son dərəcə çox adam öldürülmək, qırğın olmaq. *Ömər koxa başa düşdü ki, oğlu bir himə bənddir, əgər ona bir balaca işarə etsə, bütün Çıraqlıları ayağa qaldırar və qan su yerinə axar.* İ.Şıxlı. **Qan tökmək** – 1) dava, müharibə etmək; 2) öldürmək. *Gah qan tökər və gah içər qan; Ol sərvi-qədə budur nişanə.* Heyran xanım. *Zahirdi qəmzənin ciyər sökməyi; Can almağı, nahaq qanlar tökməyi.* Q.Zakir. **Qan tökülmək** – adam öldürülmək, dava olmaq. *Bu yaxşı əlamət deyildi, belə hallarda mütləq qan tökülməli idi.* Çəmənzəminli. **Qan tutmaq** – 1) qatil haqqında: etdiyi cinayətin təsiri altında şüuru kütləşmək, özünü itirmək, özünü çaşdırmaq; 2) ahı tutmaq, qarğışı tutmaq. *Mən aşiq, qanlıları; Qan tutsun qanlıları; Quduz qurda dönəydim; Tutaydım qanlıları.* (Bayatı). **Qan uddurmaq** – əzab və əziyyət vermək, olmazın zəhmət və iztirab çəkdirmək, gününü qara eləmək. *Belə kafir olmaz, aşiqlərinə; Qan uddurur çanaq-çanaq gözlərin.* Q.Zakir. *Həqqi var kim, uddura hər gündə yüz qanlar sənə.* S.Ə.Şirvani. **Qan udmaq** – son dərəcə əzab və əziyyət çəkmək, zəhmətdə olmaq, iztirablı günlər keçirmək. *Ömrüm uzunu qan udaram, hali-pərişan; Kirpiklərin, ol sinəvü ol zülfün əlindən.* Heyran xanım. **Qana boyanmaq** – öldürülmək, qətl edilmək, yaxud yarasından çoxlu qan axmaq. [Şahnigarın] *qolları və cırıq paltarından görünən dizləri al qana boyanmışdı.* İ.Şıxlı. **Qana bulamaq** – öldürmək, qətl etmək. [Salatın:] *Qurbanın olum, ay qağa, evimizə qan salma. Amanın bir günüdü, əlini qana bulama!* İ.Şıxlı. **Qana çalxatmaq** – xatalı, qorxulu, təhlükəli işə cəlb etmək, calamaq, sövq etmək. *Evin yıxılsın mənim evimi yıxan! Qan qusasan məni qana çalxayan!* M.F.Axundzadə. **Qana dolmaq** – rəngi özünə gəlmək, canlanmaq. *Lətifənin göyərmiş dodaqları yavaş-yavaş qana dolurdu.* M.Hüseyn. **Qana düşmək** – böhtana, xataya, davaya düşmək. *Bağban deyər, məni qoyma nişana; Öldürər gözlərin, düşərsən qana.* Aşıq Məmməd Bağban. *Səgrəqib bilməsin, düşərik qana; Sərzəniş gəlməyə bəlkə canana.* Q.Zakir. **Qana qan eləmək (etmək)** – intiqam almaq, qisas almaq; qan əvəzində qan almaq. *Amandır, sən daha gəl tökmə qanım, qanə qan etmə!* Ə.Vahid. **Qana salmaq** – davaya salmaq, davaya səbəb olmaq. *Üzün təmənnası, ləbin xəyalı; Binəvanı salıb qanə, deyərmi?* Q.Zakir. *Qızarıb arizi-ali güli-tər tək meydan; Açıban ruyini eşq əhlini yüz qanə salıb.* S.Ə.Şirvani. **Qana**

**susamaq** – dava arzulamaq, qan tökmək, adam öldürmək arzusunda olmaq. *Zalım fələk xub susayıb qanıma; Bir kimsənə yoxdur gələ yanıma.* Q.Zakir. **Qanda üzmək** – çox qan tökmək, çox adam öldürmək, qırğın düzəltmək. *Görürəm qanda üzür cəlladlar.* S.Rüstəm. **Qanı batmaq** – qatili cəzasız qalmaq; qisası, intiqamı alınmamaq. *Biri əmr elədi, o biri qırdı; Qansızlar bu nahaq qanı batırdı.* B.Vahabzadə. **Qanı cuşa gəlmək** – bax **qan qaynamaq**. **Qanı halal olmaq** *məc.* – cəzaya, ölümə layiq olmaq. *Seyyida, bilməyirəm hiç nə məzhəbdi bu kim; Qan halal oldu bunun qəmzeyi-xunxarəsinə.* S.Ə.Şirvani. **Qanı qaçmaq** – bənizi saralmaq, ağarmaq, solmaq. *Saralıb rəngi-rüxün, ləblərinin qanı qaçıb.* S.Ə.Şirvani. *Zavallı uşağın qorxudan qanı elə qaçmışdı ki, üzünün rəngi ayaqları altındakı qardan seçilmirdi.* S.S.Axundov. **Qanı qaralmaq** – kefi pozulmaq, əhvalı təlx olmaq, çox pərt olmaq. *Səməd dayının qanı qaraldı və qəm-qüssəsi aləmi tutdu.* B.Talıblı. *Dünən yenə Şahingildə toplaşdıq. Ancaq ilk addımdan qanımız qaraldı.* S.Rəhman. [Göyçək] *Cumanı bu canavarla müqayisə etdikdə qanı qaralır.* Ə.Əbülhəsən. **Qanı qaynamaq** – çox xoşuna gəlmək, ürəkdən sevmək, alışmaq, üns tutmaq, ünsiyyət etmək. *Orxanın bu oğlana birdən-birə qanı qaynadı, onun didilmiş papağından da, cütburun çarığından da, toppuzlu çomağından da, kişi-kişi danışmağından da xoşu gəldi.* İ.Məlikzadə. **Qanı tutmaq** – ahı tutmaq, etdiyi haqsızlığın cəzasını çəkmək. *Səni, ey lalərüx, aşiqlərinin qanı tutub.* S.Ə.Şirvani. **Qanı yerdə qalmaq, qanı itmək** – bax **qanı batmaq**. [Tubu:] *Bəs İskəndər kimi cavanın qanı yerdə qalacaq idi?* Ə.Haqverdiyev. **Qanına boyanmaq** – öldürülmək. *Çəmənlər üstündə, lalələr arasında qucaqlaşaraq öz qanlarına boyanmış Zeynəb və Abbas anaları Fatmanın naləsini eşitmirdilər.* S.S.Axundov. **Qanına qəltan etmək** – çoxlu yara vuraraq öldürmək. **Qanına susamaq** – birini öldürməyi arzu etmək, birinin ölümünü ürəkdən istəmək. *Çün Nəsiminin susamış qanına yarın ləbi; Noldu, ey münkir, sana, kim qaynadı qanın yenə?* Nəsimi. *Susadım arslan kimi qanına; Hazır oldum hünərlə meydanına.* A.Səhhət. **Qanına yerimək (keçmək, işləmək)** – 1) sirayət etmək, yoluxmaq, keçmək. *..Qaraca qızın dişinin dibi qanadığı üçün, yaranı sorduqda zəhər tüpürcəklə onun qanına yerimişdi.* S.S.Axundov; 2) *məc.* iliyinə, damarına işləmək, vərdiş olmaq, kök salmaq. **Qanından keçmək** – 1) bağışlamaq, əfv etmək, qisasını almamaq; 2) özünü qurban etmək, özünü fəda etmək, canını verməyə hazır olmaq. *Verir fərmanını, keçər qanından; Tökülmüş dabana saçların, gəlin!* Aşıq Əmir. **Qanını əsirgəməmək** – bax **qanından keçmək** 2-ci mənada. *Dedi: – Əsirgəməm bir qaşıq qanı; Vəli laf vuranlar gen gündə hanı?* Q.Zakir. **Qanını içmək** – öldürmək. [Hacı Murad:] *Ay namərd oğlu namərd, hara qaçırsan, qanını içəcəyəm!* N.Vəzirov. **Qanını sormaq** – istismar etmək, zülm etmək, var-yoxunu əlindən almaq. [Rza xan Hikmət İsfahaniyə:] *Kimdir min hiylə ilə vətənin qanını soran? Sizsiniz! Xaricilərlə əlbir olub, beş qranlıq malı otuz qrana satan sizsiniz!* M.İbrahimov. **Qanını tökmək** – öldürmək. *Qanını tökdü gözün hər ləhzə bir sövda ilən.* Nəsimi. **Qanını yerdə qoymamaq** – qatilin cəzasını vermək, öldürülənin intiqamını almaq. [Rüstəm bəy:] *Rəşid! ..Sənin qanını yerdə qoymaram, oğul! Qəbirdə rahat yat... Hərgah meydanda tək də qalsam, genə düşməndən əl çəkməyəcəyəm.* N.Vəzirov. **Qanının arasına girmək** – çox çətin və ya qorxulu vəziyyətə düşən bir adamı bu vəziyyətdən qurtarmaq, birinin nicatına səbəb olmaq. *Mən onun qanının arasına girdim, yoxsa onu sel aparmışdı. – Onların direktoru başlayacaq ki, mən Xəlilin qanının arasına girdim. Axı biz də özümüzə görə bir kişiyik.* M.Hüseyn. **Ürəyi, ciyəri qana dönmək (qan olmaq)** – iztirablı hal keçirmək, çox mütəəssir olmaq. *Dərdü qəm çəkməkdən qan olub ciyər; Gətirən yox nazlı yardan bir xəbər.* Q.Zakir. *Qəmin əlində, ilahi, dönüb ürək qanə.* M.Hadi.

**QANACAQ** *is.* 1. Düşüncə, şüur, anlaq. *Amma mənim qanacağıma görə, sizin kitabınızda olan məlumat məhz Avropa və Rusiya mənbəyindən əxz olunmuşdur.* C.Məmmədquluzadə. *Dil eyni zamanda şəxsiyyətin qabiliyyət və qanacaq dərəcəsini bildirən bir məhək daşıdır.* M.İbrahimov.

2. Ədəb, mərifət, tərbiyə. *Bu adamda heç bir qanacaq yoxdur.*

3. Zehniyyət, görüş mənasında. *Bəs hər zəmanənin bir qanacağı var ki, bu qanacağı ol zəmanənin kitablarından, xalqının adətlərindən, işlətdiyi əsbab və qeyrədən bilmək olur.* N.Vəzirov.

**QANACAQLI** *sif.* Qanacağı olan, mərifətli, şüurlu, düşüncəli, anlaqlı; ədəbli, nəzakətli. *Qanacaqlı adam. Qanacaqlı uşaq. – Bir də, dedim, Mirzə Qulam qanacaqlı adama oxşayır.* Mir Cəlal. *Kərim kəndin hünərli, yetkin bir gənci, mahir bir ovçusu, qanacaqlı bir xeyir-şər adamı olurdu.* S.Rəhimov.

**QANACAQLILIQ** *is.* Mərifətlilik, düşüncəlilik, anlaqlılıq; ədəblilik, nəzakətlilik.

**QANACAQSIZ** *sif.* Qanacağı olmayan, düşüncəsiz, mərifətsiz, anlamaz, ədəbsiz. *Qanacaqsız adam. Qanacaqsız hərəkət.*

**QANACAQSIZLIQ** *is.* Düşüncəsizlik, mərifətsizlik, anlamazlıq, ədəbsizlik, nəzakətsizlik; düşüncəsiz hərəkət.

**QANAD** *is.* 1. Quşlarda və cücülərdə uçmaq orqanı. *Quş qanadı. Qanad açıb uçmaq. Göyərçinin qanadı. Milçəklər qanadlarında, xortumlarında və ayaqlarında külli miqdarda mikroblar gəzdirir.*

2. Təyyarənin qalxma qüvvəsini yaradan, hər iki tərəfindəki yastı səthlərdən hər biri. *Təyyarənin sol qanadı. – Budur, sağ tərəfdə bir təyyarə var; Onun qanadından topla vurublar.* M.Rahim.

3. Yel dəyirmanının fırlanan pəri. *Dəyirmanın qanadı küləyə doğrudur.*

4. Balıqlarda: üzməyə məxsus üzvlər, pərək. *Bəzi balıqların iki, bəzilərinin isə dörd qanadı olur.*

5. Qapı və pəncərə kimi şeylərin açılıb-örtülən və çox zaman cüt olan tağlarından, taylarından hər biri. *Pəncərənin bir qanadı açılmır.*

6. Bir şeyin iki tərəfindən hər biri. *Hər ikisi salonun sağ qanadındakı dördüncü lojaya dirsəklənərək səhnədə incə .. rəqqasələri seyr edirdilər.* A.Şaiq.

7. Hər hansı bir təşkilatın, partiyanın ifrat (sol və ya sağ) qrupu.

8. Uc, kənar, qıraq. // Budaq. *Həcər çaya düşərkən əl atıb bir ağacın qanadından yapışdı.* S.Rəhimov.

9. Cəbhənin, qoşunun, sıranın sol və ya sağ tərəfi; cinah.

10. Əsas şeydən ayrılmış qol. *Bu geniş maşın yolundan isə bir qanad ayrılaraq, Ağbulağın ortasına gətirilmişdi.* S.Rəhimov.

◊ **Qanad açmaq** *şair.* – uçmaq, qanadlanmaq. *Azadlığın böyük qəlbi qartal kimi qanad açır.* S.Vurğun. **Qanad çalmaq** – qanad vurmaq, uçmaq. *Asta qanad çalın qafil telləri; Hayıfdır, salarsız düzə, durnalar!* M.P.Vaqif. [Qızılquş] *xeyli sonra enib, ovlağın üstündə qanad çala-çala* (z.) *dövrə vurub beləcə qayıtdı.* S.Rəhimov. **Qanad çırpmaq** – uçmaq, qanadlanmaq. **Qanad-quyruq bağlamaq** – pərvazlanmaq, cana gəlmək, canlanmaq, qüvvətlənmək. **Qanad vermək** – b a x **qanadlandırmaq**. *Gəlir qonşuluqdan piano səsi; Qəlbə qanad verir onun nəğməsi.* S.Vurğun. *Müəllim yüksəlişçin şagirdə qanad verir.* M.Seyidzadə. **Qanad(ını) gərmək** – 1) qanad açmaq, qanadını gərgin surətdə açmaq; 2) *məc.* himayəsi altına almaq, qorumaq; 3) *məc.* başının üstünü almaq, üstünü tutmaq, çökmək. *Kənd üzərində qəmli və dərin bir sükut öz qanadlarını gərir..* M.Hüseyn. *Qanadını gərir axşam; Soyuq keçir ürəyimdən!* S.Vurğun. **Qanadı altına almaq** – himayəsinə götürmək, qorumaq. *Həcərin karlı qardaşları var. Bunlar bacılarının xatiri üçün Alı kişini öz qanadları altına alıb saxladılar.* "Qaçaq Nəbi". *Anaxanım kiçik balasını öz ana qanadları altına alıb böyütməyə başladı.* A.Şaiq. **Qanadı qırılmaq (sınmaq)** – köməksiz və himayəsiz qalmaq, ən yaxın adamından məhrum olmaq, bədbəxtlik üz vermək.

**QANADLANDIRMA** "Qanadlandırmaq"dan *f.is.*

**QANADLANDIRMAQ** *f.* Ürəkləndirmək, ruhlandırmaq, cürətləndirmək, ruh vermək.

**QANADLANMA** "Qanadlanmaq"dan *f.is.*

**QANADLANMAQ** *f.* 1. Qanad çıxarmaq, qanadı çıxmaq, pərvazlanmaq. *Çəyirtkə qanadlanınca qabağını almaq çətin olur.*

2. Uçmaq, qanad açmaq, qanad çalıb uçmaq. *Göyərçin qanadlanıb uçdu. – Qırğı, oturduğu kötüyün üstündən boynunu burub qıyıldadı və dərhal qanadlanaraq Cəfər əminin çiyninə qondu.* H.Nəzərli. // Uçmaq, havalanmaq. *Təyyarə dairələr cızaraq yüksəklərə qanadlandı.* Ə.Məmmədxanlı.

3. Yellənmək. ..*Qanadlanan kəlağayı qara saçlarla birlikdə yellənir; Bəyimi göylərdə uçan bir mələkə bənzədirdi.* Çəmənzəminli.

4. *məc.* Son dərəcə sevinmək, ruhlanmaq, həvəslənmək, ürəklənmək. *Qanadlan hüsnü eşq ilə; Məkanın asimanlardır.* S.Vurğun. *Yenə könlümdə qanadlandı sevinc.* M.Müşfiq.

5. *məc.* Yüksəlmək, inkişaf etmək. *C.Cabbarlının dramatik istedadı .. bütün vüsəti ilə inkişaf edib qanadlandı.* M.İbrahimov.

6. *məc.* Üzərinə cummaq, şığımaq. *Tahir atını tərpədib ilxının yanından keçirkən, bir ağ ayğır ilxıdan çıxıb quzğun kimi göy xallı atın üstünə qanadlandı.* S.Rəhimov.

**QANADLANMIŞ** *f.sif.* Qanad çıxarmış, uçacaq hala gəlmiş, pərvazlanmış; pərvaz. *Qanadlanmış quş.* // Obrazlı təşbehlərdə. *Ürəyim qanadlanmış quş kimi hey çırpınır əsəbi.* R.Rza.

**QANADLI** *sif.* 1. Qanadı olan, qanad çıxarmış. *Qanadlı qarışqa.* – *Bir az keçmədən qırmızı qanadlı arılar qocanın başı üstünə qalxdı.* S.Rəhimov.

2. *məc.* Çox iti uçan, çox iti gedən. *Hünərim, qüvvətim bitməz, tükənməz; Qanadlı bir şahin yerdə sürünməz.* A.Şaiq. *Məncə fürsət qanadlı bir quşdur; Kim ki əldən uçursa, sərxoşdur.* H.Cavid. *Sevgim mübarizə, sevgilim həyat; Yəhərlənmiş bana qanadlı bir at.* M.Müşfiq.

**QANADLICA** *is. məh. bot.* Müxtəlif növləri olan ot-bitki.

**QANADSIZ** *sif.* 1. Qanadı olmayan, qanad çıxarmamış, yaxud qanadı qırılmış. *Qanadsız arı.* – *Qanadsız bir quşa bənzər; Gənclik, yoxsa şux xəyalı.* N.Rəfibəyli. *Eyb etməz uçuşda yıxılsan bir an; Təki deməsinlər qanadsız quşdur.* M.Araz.

2. *məc.* Yaradıcı qüvvədən, xəyaldan məhrum. *Əməlsiz elm qanadsız oxdur.* (Məsəl).

**QANAXMA** *is.* Qan damarlarından qanın dışarıya çıxıb axması. *Yaralı qanaxmadan tələf oldu.*

**QANALMA** *is. tib.* Müalicə məqsədi ilə bədəndən qan axıtma.

**QANAMA** "Qanamaq"dan *f.is.*

**QANAMAQ** *f.* Dərinin yaralanması, zədələnməsi və s. nəticəsində damardan qan çıxmaq, qan axmaq, qan sızmaq. *Əli qanamaq. Burnu qanamaq. Barmağı qanamaq.* – *Xudayar bəy ancaq indi başa düşdü ki, üzü bir neçə yerdən qanayıb.* C.Məmmədquluzadə.

**QANATDIRMAQ** *f.* Qanamasına səbəb olmaq.

**QANATMA** "Qanatmaq"dan *f.is.*

**QANATMAQ** *f.* Qan axacaq surətdə yaralamaq, yaxud yaranı qurdalayaraq, bir şey toxunduraraq qanamasına səbəb olmaq, qan axdırmaq. *Ata, gedəcəyəm! Ya öləcəyəm, ya da gedib oxuyacağam! – dedim. Bunun üstündə də o mənim ağız-burnumu qanatdı.* M.İbrahimov.

**QANAVAT** *is.* Qalın, miləmil ipək parça. // Bu parçadan tikilmiş. *Qanavat yorğan.* – *Xozeyinlər hamama gələndə özləri üçün qanavat boğçanın içində fitə, qətfə gətirərdilər.* H.Sarabski.

**QANAZLIĞI** *is. tib.* Qanda qırmızı qan kürəciklərinin (hemoqlobin) azlığı nəticəsində əmələ gələn xəstəlik.

**QANBİR** *sif.* Bir qandan, bir nəsildən, bir soydan olan. *Kassir ilə dədə-babadan qanbir qohum çıxanlar bir-birinə yapışmışdılar.* Mir Cəlal.

**QANBUR** b a x **qozbel**.

**QANBURLAŞMA** "Qanburlaşmaq"dan *f.is.*

**QANBURLAŞMAQ** *f.* Qanbur olmaq, donqarlaşmaq, qozbel olmaq.

**QANBURLUQ** *is.* Qozbellik, donqarlıq.

**QANCIĞA** *is.* Yəhərin dal və bəzən qabaq tərəfində ip, qayış keçirmək üçün deşik, ya halqa. ◻ **Qancığa bağı** – heybə və s. bağlamaq üçün yəhərin arxa, bəzən qabaq tərəfində asılan iki nazik və uzunca qayış.

**QANCIQ** *sif.* və *is. dan.* Eşşəyin, qatırın, itin, canavarın dişisi.

**QANCIQLIQ** *is. vulq.* Xəyanət, alçaqlıq, rəzillik, dönüklük.

**QANÇIR** *is.* 1. Bərk vurulmaq, toxunmaq və ya sıxılmaq nəticəsində bədənin bir yerində dəri ilə ət arasında bərkiyib laxtalaşan qan. [Qarı] *Mahmudun üz-gözündən döyülmək nişanəsi olan qançıra baxıb dedi..* Ə.Əbülhəsən.

2. Bərk soyuqdəymə nəticəsində qanın bədəndə donması, istiliyini itirməsi. *Şaxtadan az qala qançır olmuşdum.*

**QANÇIRLAMA** "Qançırlamaq"dan *f.is.*

**QANÇIRLAMAQ** *f.* Qançır olmaq.

**QANÇIRLANMAQ** bax **qançırlamaq**. *Bütün vücudunda göyərib qaralmayan, qançırlanmayan bir nöqtə olmadığı görülərdi.* Ə.Əbülhəsən.

**QANDA** "Harada" sözünün qədimi forması. *Hər qanda məskən eyləsə aşiq, əsirdir.* Nəsimi. *Qanmayır heç kəs ki, kəşti qanda, dərya qandadır.* M.Ə.Sabir.

**QANDAL** *is.* [əsli *ər.*] 1. Keçmişdə ağır cinayət işləmiş məhbusların əl və ayaqlarına keçirilən dəmir halqalı zəncir. [Çingiz:] *Məgər Əlimərdanın Sibirdə əlləri, ayaqları qandalda sızıldamasına səbəb binamus Şahbaz bəy olmuşdur?* S.S.Axundov. *Zəncir və qandal cingiltisi kameradakı həyəcanı daha da gücləndirirdi.* M.Hüseyn.

2. *məc.* Maneə, buxov mənasında.

**QANDALAQ** bax **qandal**. *Qandalaq qoymayır gecələr yatam; Ümid etməyirəm mətləbə çatam.* "Qaçaq Nəbi". *Məşədi isə hər zaman atasını, onun qollarındakı zənciri, ayaqlarındakı qandalağı xatırlayıb, "oğlunu oxutdur" sözlərini yadından çıxartmırdı.* M.Hüseyn.

**QANDALLAMA** "Qandallamaq"dan *f.is.*

**QANDALLAMAQ** *f.* Əl və ayaqlara qandal vurmaq, buxovlamaq, zəncirləmək.

**QANDALLANMA** "Qandallanmaq"dan *f.is.*

**QANDALLANMAQ** *məch.* Əl və ayaqlarına qandal vurulmaq; buxovlanmaq, zəncirlənmək.

**QANDALLI** *sif.* Əl və ayaqlarına qandal vurulmuş; buxovlu, zəncirli. *Araz dəhlizdəki ayağı qandallı dustaqlara baxırdı.* A.Şaiq.

**QANDAYANDIRICI** bax **qankəsici**.

**QANDIRILMAQ** *məch.* Anladılmaq, başa salınmaq, bildirilmək, öyrədilmək.

**QANDIRMA** "Qandırmaq"dan *f.is.*

**QANDIRMAQ** *f.* Anlatmaq, başa salmaq. *Nə qədər çalışdımsa, məsələni ona qandıra bilmədim. – Sən öz borcunu əmələ gətir, .. vəssəlam, budur bax, qlasnı seçmə barəsində başladın, axırı nə, Ağa Dərviş! Nə üçün danışmırsan, qandırmırsan?* N.Vəzirov. [İmran:] *..Amma bunu atana qandırmaq mümkündürmü?* S.S.Axundov.

**QANE** [*ər.*] Qane olan, əldə etdiyi, yaxud əlində olan şeylə kifayətlənən, tamah etməyən. *Nə versələr, ona qaneyəm.* ☐ **Qane etmək** – kifayətləndirmək, razı etmək, təmin etmək, inandırmaq. *Arazı bu cavab qane etmədi.* A.Şaiq. *Bütün hücum növləri içərisində Ulduzu ən çox qane edən tank hücumları idi.* Ə.Məmmədxanlı. **Qane olmaq** – kifayətlənmək, razı olmaq. *Aza qane olmayan çoxa yetişməz.* (Ata. sözü). [Ağa Mərdan:] *İkinci təklif budur ki, gərək Hacı Qafurun dövlətinin yarısına qane olasan.* M.F.Axundzadə. *Tapmasan saf, dürrə, ol qane; Ki, sənə kimsənə deyil mane.* S.Ə.Şirvani. *Leytenant xəyalında kapitanı dinləyir, onun dəlil və sübutları ilə qane olmayaraq, ürəyində kəskinliklə danışırdı.* Ə.Əbülhəsən.

**QANEEDİCİ** *sif.* Qane edən, kifayətləndirən, razı edən, təmin edən, inandırıcı. *Qaneedici cavab.*

**QANIACI** *sif. dan.* Ətiacı, zəhəndə, hər şeyin ziddinə gedən, acı danışan. *Qanıacı adam.*

**QANIACILIQ** *is. dan.* Qanıacı adamın xasiyyəti; ətiacılıq, zəhəndəlik.

**QANIAÇIQ** *sif.* Solğun, bənizi qaçmış. *Kukla kök-qırmızı, Roza qanıaçıq və arıq idi.* S.Rəhimov.

**QANIXDIRMAQ** bax **qanıqdırmaq**.

**QANIXMAQ** bax **qanıqmaq**. *Belə getsə onların dişi şirəyə batar, qanıxarlar, bu kənddə adam qalmaz.* S.Rəhimov. *Qan içib qanıxan canavarları; Məhv et silahının qüdrətiylə sən.* R.Rza.

**QANIXSAMAQ, QANIXSIMAQ** bax **qanıqmaq**.

**QANIİSTİ** *sif.* Adama yovuşan, adamlarla üns tutan; ünsiyyətli, səmimi. *Qanıisti adam.*

**QANIİSTİLİK** *is.* Adama yovuşma, ünsiyyət.

**QANIQ** *sif.* 1. Qana yerikləyən, qana susamış, qana həris. // *İs. mənasında*. Sərt, azğın, bəd, quduz kimi it. *Fit verdim getdilər, yaxınlaşıb nə gördüm, .. qanıq minib canavarın belinə, qarpıb boynunu dalısından.* N.Vəzirov.

2. Həris, dadanmış, alışqan, vərdişli. ☐ **Qanıq etmək** – dadandırmaq, alışdırmaq. **Qanıq olmaq** – həris olmaq, yerikləmək. *Milçək qana qanıq olar.* **Qanıq salmaq** – razı salmaq, təmin etmək, toxtatmaq.

**QANIQARA** *zərf* Çox pərt, çox tutqun, əhvalı pozğun halda. *Dəniz buruğundan daha da qanıqara qayıtmış Qüdrət, Laləni yuxudan*

*oyatmadı.* M.Hüseyn. *Kəbleyi başmaqlarını çıxarıb əlinə alaraq qanıqara deyinə-deyinə evə qayıdır.* H.Sarabski.

**QANIQARALIQ** *is.* Pərtlik, məyusluq, əhval pozğunluğu. [Yusif:] *Yox, Qəmər, bir də Camala rast gəlsəm, qanıqaralıq olacaq.* S.Rəhman.

**QANIQDIRMAQ** *f.* Alışdırmaq, dadandırmaq.

**QANIQMA** "Qanıqmaq"dan *f.is.*

**QANIQMAQ** *f.* 1. Alışmaq, dadanmaq; həris olmaq. *Bu tula ov etməyə qanıqmışdır.*

2. Qana susamaq, gözü qızmaq.

**QANIQSAMAQ, QANIQSIMAQ** b a x **qanıqmaq** 2-ci mənada.

**QANILMAQ** *məch.* Başa düşülmək. *Həzrət Əşrəf Hacı Nayibə qanılmayan dildə yavaş-yavaş bir söz deyir.* C.Məmmədquluzadə.

**QANILMAZ** *sif.* Qanıla bilməyən, başa düşülə bilməyən.

**QANIRILMAQ** 1. "Qanırmaq"dan *məch.*

2. *f.* Çevrilmək, dönmək. [Nadir] *dərhal məstliyindən ayıldı və qanırılıb baxdıqda Məstan bəyi gördü.* B.Talıblı.

**QANIRMA** "Qanırmaq"dan *f.is.*

**QANIRMAQ** *f.* Burmaq, əymək, qatlamaq, bükmək, qarmaq, çevirmək. *Yenə bir-birinə yanaşdılar, bu dəfə başlarını qanırıb, peysərlərini bir-birinə sürtüb, ayrıldılar.* Çəmənzəminli. *Qüvvətli bir kəndli onun* [Səmədin] *sağ biləyini qanırdı, xəncəri dartıb əlindən aldı.* M.Hüseyn.

**QANIRTMAQ** "Qanırmaq"dan *icb.*

**QANISOYUQ** *sif.* Adamayovuşmaz, adamdanqaçan, adama isinişməyən; üzügülməz; xoşa gəlməyən. *Qanısoyuq adam. O, çox qanısoyuqdur. – ..Şəhərimizdə yaxşı və namuslu adamlarla bərabər, üzüdönük və qanısoyuq adamların da olduğunu boynumuza almalıyıq.* M.S.Ordubadi.

**QANISOYUQLUQ** *is.* Adama yovuşmama, adamdan qaçma, adama isinişməmə; qanısoyuq adamın keyfiyyəti.

**QANIŞİRİN** *sif.* Adamların rəğbətini özünə cəlb edən, özünə qarşı hüsn-rəğbət oyadan; sevimli, qanıisti. *Qanışirin adam. Qanışirin uşaq.*

**QANIŞİRİNLİK** *is.* Qanışirin adamın keyfiyyəti; sevimlilik, qanıistilik.

**QANİÇƏN** *sif.* Zalım, qəddar, rəhmsiz, vəhşi. *Simaca kafir, qaniçən, talançı və cəsur olan bu tayfa* [hun tayfası] .. *hədsiz zülmlər etmişlər.* A.Bakıxanov. *..Daşqəlbli qaniçən qazaqlar .. zavallı işçiləri bacardıqca qılıncdan keçirirdilər.* S.S.Axundov. // İstismarçı, qansoran, tüfeyli. // İs. mənasında. [Fərman:] *..Ağa Mirzə Əhməd də canavarların, qaniçənlərin böyüyüdür.* Ə.Haqverdiyev.

**QANİÇİCİ** b a x **qaniçən**. *Gördülər qaniçici gözlərini əhli-nəzər; Bu sitəmkarları axırda tutar qan, dedilər.* S.Ə.Şirvani. *Qaniçici faşistlərin məzarlıqdır yalnız yeri.* S.Vurğun. [Pəricahan:] *Sən elə qaniçici, dünyanı oda tutub viran edənlər tərəfinə keçməzsən.* S.S.Axundov. [Çar] *hökuməti canilərin, qatillərin, julik və avantüristlərin, rüşvətxor və qaniçici parazitlərin yaramaz əməllərinə göz yumurdu.* H.Sarabski.

**QANİÇİCİLİK** *is.* Zalımlıq, qəddarlıq, rəhmsizlik, vəhşilik.

**QANKƏSƏN** b a x **qankəsici**. *Qankəsən ot.*

**QANKƏSİCİ** *sif.* Qan axmasını dayandıran. *Qankəsici dərman.*

**QANKÖÇÜRMƏ** *is. tib.* Müalicə məqsədi ilə xəstənin bədəninə başqasından alınmış qanı, yaxud öz bədəninin bir yerindən alınmış qanı başqa yerinə yeritmə. *Qanköçürmə üsulundan yalnız əsil qan xəstəliklərinin deyil, bir çox başqa xəstəliklərin müalicəsində də müvəffəqiyyətlə istifadə etmək olar.*

**QANQAL** *is. bot.* Yarpağı tikanlı, özəyi yeyilən alaq bitkisi; qalağan. *Qanqallar da çiçək açmışdı.* İ.Əfəndiyev. *Onlar kəndi keçmişdilər. Şahnigar bunu bilsə də dinmir, qanqalların arası ilə irəliləyirdi.* İ.Şıxlı.

**QANQALLI** *sif.* Qanqal bitən, qanqalı çox olan. *Qanqallı əkin. Qanqallı çöllər.*

**QANQALLIQ** *is.* Çoxlu qanqal bitən yer. *Belə bəhs edərək, gəlib bir kolluq və qanqallıq yerdə qazılmış qəbrə çatdılar.* S.S.Axundov. *Uzunqulaq özünü evin yan tərəfinə, qanqallığa verdi.* S.Rəhimov.

**QANQARALDAN** *sif.* Əhvalı pozan, pərt edən, əsəbiləşdirən. *Qanqaraldan söz.*

**QANQARALDICI** *sif.* b a x **qanqaraldan**. *Qanqaraldıcı söz. Qanqaraldıcı xəbər.*

**QANQI, QANQU** "Hansı" sözünün qədimi forması. *Vəsfində Nəsimi sözünü ərşə*

*çıxardı; Qanqı sədəfin incisi buldu bu nizami?* Nəsimi.

**QANQIMAQ** *f. məh*. Diləmək, yalvarmaq, arzusunda olmaq, həsrətində olmaq. *Sail, qapıdan baxma bizə, pis göz atarsan! Çox qanqıma, durram, elə vurram ki, batarsan!* M.Ə.Sabir.

**QANQIRMIZI** *sif.* Qan kimi qırmızı, qıpqırmızı. *Gözlərdə dolaşan qanqırmızı su; Ötən yarışların nəticəsiydi.* M.Müşfiq.

**QANQRÉN** [*yun.*] *tib*. Qan dövranının pozulması nəticəsində toxuma və ya bədənin bir yerinin çürüyərək ölməsi. *Ayağı qanqren olmaq*.

**QANQRENLİ** *sif. tib*. Qanqren olmuş. *Qanqrenli barmaq*.

**QANQSTER** *is.* [*ing*.] Quldur, soyğunçu, bandit.

**QANQURUDAN** 1. *is. bot*. Qan dayandırmaq üçün xalq təbabətində işlədilən bir bitki.

2. *sif.* Axan qanı qurudan, dayandıran. *Qanqurudan dərman*.

**QANLI** *sif.* 1. Qana batmış, qana bulaşmış. *Qanlı paltar. Qanlı silah. – Fəhlələrdən bir neçə nəfəri Qurbanın qanlı cənazəsini kazarmaya gətirirlər*. M.İbrahimov.

2. Qanla dolu, qanla qarışıq, içində qan olan. *Qanlı irin. Qanlı ishal. Qanlı, yara*.

3. Çoxlu qurbanlara, çoxlu adam qırılmasına, çoxlu qan axıdılmasına səbəb olan. *Qanlı toqquşma. Qanlı vuruşma. – Qanlı müharibələrin şahidi olan İçərişəhər hər yandan qalın barı və bürclərlə əhatə edilmişdi*. A.Şaiq. *Açılmasın qanlı hərbin bir də qara qanadları*. M.Dilbazi. // *məc.* Öldürücü, canalıcı. *Könül dost kuyinə etdikcə güzər; Qanlı qəmzəsinə etməzmi həzər?* M.V.Vidadi.

4. Öz vəhşilikləri ilə, adam öldürməklə özünü ləkələmiş, vəhşi, yırtıcı. *Faşizmin qanlı cəlladları*.

5. *is.* Qatil. *Qanlıdan qada əskik olmaz*. (Ata. sözü). *Gəh gözdə, gəh könüldə xədəngin məkan tutar; Hər qanda olsa qanlını, əlbəttə, qan tutar.* Füzuli. *Əzrayılı qanlı tutmasın anam; Məni bir kirpiyi peykan öldürür...* Aşıq Ələsgər. *Doğrudur, xalqın sözü: Qanlını qan tutarmış; Bəzən də bir içim su əjdahanı boğarmış*. H.Cavid. // Düşmən, qan düşməni. [Əsəd bəy:] *Hər bir halda qanlı qanlıdan əl çəkməz*. C.Cabbarlı. *Bir oxla ayrılmışdı Sara nişanlısından; Düşündü: "İntiqam al, gəl, onun qanlısından*". Ə.Cavad. *Burada* [Göytəpədə] *çox adamlar əlini Qurana basıb günahsız olduğuna and içmiş, çox qanlılar barışdırılmışdı.* İ.Şıxlı.

6. Çox bişməmiş, çiyhal, alabişmiş. *İgid canlı, kabab qanlı* (*gərək*). (Məsəl).

7. *məc. dan*. Qeyrətçəkən, təəssübçəkən; öz xalqının və vətəninin təəssübünü, qeyrətini çəkən. *O, çox qanlı adamdır*.

◊ **Qanlı göz yaşları** – acı-acı ağlama, yanıqlı-yanıqlı ağlama. *Dizi üstə əzəl alıb başımı; Sildi lütf ilə qanlı göz yaşımı*. A.Səhhət.

**qanlı-qanlı** *zərf* Düşməncəsinə, qeyzlə, acıqlı-acıqlı. *Usta yenə arabir Tahirə qanlı-qanlı baxır, narazı halda başını bulayırdı.* M.Hüseyn.

**QANLIBIÇAQ** *is. dan.* Düşmən. *Amma Murtuza Qulu xanla araları yoxdur, qanlıbıçaqdırlar*. M.S.Ordubadi. *Ancaq o çox sadədir, tərifi-zadı sevməz; Elə bil ki, şöhrətlə qanlıbıçaq kimidir*. R.Rza. ☐ **Qanlıbıçaq olmaq** – bir-birilə düşmən olmaq; araları bərk dəymək.

**QANLI-QAÇAQ** *zərf* Düşmən, qan düşməni. [Bayram:] ..*Öldürməkdən nə hasil? Mən özüm də qanlı-qaçaq ollam*. M.F.Axundzadə.

**QANLI-QADALI** *sif.* Xatalı, qorxulu, qana bais ola bilən.

**QANLILIQ** *is.* 1. Qanlı, qana bulaşmış şeyin halı.

2. Bədəndə qan çoxluğu; dolğunluq.

3. Qatillik, canilik, adam öldürmə.

4. Köhnə məişətdə: düşmənçilik, qan ədavəti. *Camaat arasına qanlılıq düşürdü.* H.Sarabski. [Səttar:] *Mən kürdlərin arasında hökm sürən nifaqa, qanlılığa təəssüflənirəm.* P.Makulu.

**QANMA** "Qanmaq"dan *f.is.*

**QANMAQ** *f.* Anlamaq, başa düşmək. [Şahbaz bəy:] *Əmi, qanmıram ki, siz necə Parij əhlinin adət və xəvasından xəbərdarsınız?* M.F.Axundzadə. [Səfdərqulu:] *Vallah, mən bilmirəm sən məndən nə istəyirsən, qana bilmirəm, nə qədər fikir eləyirəm, qana bilmirəm*. N.Vəzirov.

**qana-qana** *zərf* Bilə-bilə, qəsdən. *Sözü qana-qana dur; Çəkin, yana-yana dur; Daha məni görməzsən; Sızla, yana-yana dur!* (Bayatı).

**QANMAZ** *sif.* Anlamaz, anlaqsız, düşüncəsiz, qanacaqsız; ədəbsiz, tərbiyəsiz. *..Bir para qanmaz adamlar gedib özgəsinin yaxasından yapışar, o da gəlib sizin yaxanızdan yapışar, siz də mənim, mən də sizin, axırda qalmaqal çıxar.* "Mol. Nəsr.".

**QANMAZCASINA** *zərf* Ədəbsizcəsinə, heyvancasına.

**QANMAZLIQ** *is.* Anlamazlıq, düşüncəsizlik, qanacaqsızlıq, tərbiyəsizlik. [Kosaoğlu:] *Özünü niyə qanmazlığa qoyursan? Səni əsgərlikdən saxladım, kolxozun yerini verdim, bostan əkdin.* İ.Şıxlı.

**QANOTU** *is. bot.* Nəm yerlərdə, su kənarlarında, əkinlərin arasında və zibilli yerlərdə bitən birillik bitki.

**QANOV** [*rus.* канава] *Arx. Qarlar əridikcə əmələ gələn sular qanovlara gedə bilmir, yolun ortasında qalırdı.* Ə.Əbülhəsən.

**QANOVUZ** *is.* [*fars.*] Əksərən al-əlvan olan zərif ipək parça. // Bu parçadan tikilmiş. *Qanovuz köynək. Qanovuz yorğan. – Su götürdüm hovuzdan; Seçilmərəm tovuzdan; Mənə bir xəbər deyin; Köynəyi qanovuzdan.* (Bayatı). [Gülyaz] *anasının böyük ağac sandığında çoxdan bəri büküb saxladığı təzə qanovuz paltarını geyinər, toylara gedər, .. məharətlə oynardı.* M.Hüseyn.

**QANOVUZU** *sif.* Tünd, pürrəng. *Şamama dəmdə olan ağ samovardan, qədimlərdə deyildiyi kimi, qanovuzu bir çay töküb gilənar mürəbbəsi ilə mənim qabağıma qoyur.* İ.Əfəndiyev.

**QANRILMAQ** *f.* Çevrilmək, dönmək, üzünü çevirmək. *Fərhad arabir qanrılıb geri baxır və döyüşçülərin nə cür gəldiyini yoxlayırdı.* Ə.Vəliyev. *Molla qanrılıb baxdı. O, əli şahinli xanın gəldiyini görüb, yola tərəf çevrildi.* S.Rəhimov. *Qulam güclə qanrılan boynunu döndərib Kəyana baxmağa çalışdı..* Ə.Əbülhəsən.

**QANSIZ** 1. *sif.* Qanı az olan, zəif, cansız. // Qanı qaçmış, rəngi qaçmış, solğun. *Qansız dodaqları tərpəndisə də, səs gəlmədi.* Çəmənzəminli.

2. *zərf* Qan tökülmədən, qurban verilmədən. [Zeynəb:] *Azadlıq qansız və qurbansız qazanılmaz.* M.S.Ordubadi.

3. *məc.* Rəhmsiz, mərhəmətsiz, insafsız, mürüvvətsiz, amansız, qəddar. *Nə qansız adamsan, a kişi!* Mir Cəlal. // Qeyrətsiz, şərəfsiz, vicdansız. [Salman:] *Bizi, öz yoldaşlarını, lap açığı, öz qardaşını təhlükədə qoyub qaçar qədər qansız zənn edirsən?* C.Cabbarlı.

**QANSIZLAŞDIRILMA** "Qansızlaşdırılmaq"dan *f.is.*

**QANSIZLAŞDIRILMAQ** *məch.* Qanı azaldılmaq, qansız hala salınmaq.

**QANSIZLAŞDIRMA** "Qansızlaşdırmaq"dan *f.is.*

**QANSIZLAŞDIRMAQ** *f.* Qanını azaltmaq, qansız bir hala gətirmək; yeməyini azaltmaq və ya çox yormaq nəticəsində zəiflətmək.

**QANSIZLAŞMA** "Qansızlaşmaq"dan *f.is.*

**QANSIZLAŞMAQ** *f.* Qanı azalmaq, qansız bir hala gəlmək, yeməmək və ya yorğunluq nəticəsində qansız olmaq, zəifləşmək. // Ağarmaq, solmaq, qırmızılığını itirmək. *Dodaqları qansızlaşmaq.*

**QANSIZLIQ** *is.* 1. Qanı azalma, qan azlığı; qanda qırmızı kürəciklərin azlığı nəticəsində əmələ gələn hal. *İgid bir vəqt qansızlara qan verər; Bir vəqt özü qansızlıqdan can verər.* Şəhriyar.

2. *məc.* Rəhmsizlik, insafsızlıq, vicdansızlıq; sərtlik, heç kəsə ürəyi yanmama.

**QANSORAN** *is.* və *sif.* Özgələrin hesabına yaşayan; istismarçı; zalım, qaniçən. *Mənim azadlığım qansoranların; Cındır maskasını yırtmaq üçündür!* X.Rza.

**QANTAR** *is. köhn.* 1. B a x **qapan**[1].

2. Qədimdə işlənmiş ölçü vahidi.

**QANTARÇI** *is. köhn.* b a x **qapançı**.

**QANTARÇILIQ** *is. köhn.* b a x **qapançılıq**.

**QANTARĞA** *is.* Yüyənin, atın ağzına keçirdilən qoşa dəmir hissəsi, cilovu. *Dəliqanlılar dəstəsindən ayrılıb gələn bir nəfər Sadığa yanaşdı, atının qantarğasından tutdu.* M.Hüseyn.

**QANTARĞALAMA** "Qantarğalamaq"dan *f.is.*

**QANTARĞALAMAQ** *f.* 1. Atın ağzına yüyən vurmaq, yüyənləmək.

2. *məc.* Qabağını almaq, cilovlamaq. *Sən də ey.. Azğın suları qantarğalayan, dur! Dayan!* R.Rza.

**QANTARĞALANMA** "Qantarğalanmaq"-dan *f.is.*

**QANTARĞALANMAQ** *məch.* Yüyən vurulmaq, yüyənlənmək, cilovlanmaq.

**QANTARĞALATMAQ** *icb.* Yüyənlətmək, yüyən vurdurmaq, cilovlatmaq.

**QANTARĞALI** *sif.* Ağzı yüyənli, yüyənlənmiş, cilovlu.

**QANTARĞASIZ** *sif.* Ağzı yüyənsiz, yüyənlənməmiş, cilovsuz.

**QANTƏPƏR** *is. bot.* Xalq təbabətində işlənən ağ çiçəkli dağ bitkisi. *Kəndin qarıları Qəhrəmana qantəpər deyilən çiçəyin çayını içirdilər.* S.Rəhimov.

**QAN-TƏR** *is.* Çox ağır, əziyyətli, yorucu, gərgin iş nəticəsində bərk tərləmə. *Su gəlir lülə-lülə; Yar gəlir gülə-gülə; Əlində güllü dəsmal; Qan-tərin silə-silə.* (Bayatı). □ **Qan-tər içində** – zəhmətlə, məşəqqətlə, çox böyük zəhmət çəkərək, tər tökə-tökə. *Kəndli dedi: – Düzünü axtarsanız, hökumətin sütunu biz kəndlilərlə o qan-tər içində yük daşıyan fəhlələrdir.* S.S.Axundov. [Qoca Firuz] *qan-tər içində işləyirdi.* Ə.Məmmədxanlı. **Qan-tər tökmək** – bax **qan-tərə batmaq** 2-ci mənada. **Qan-tərdə** – bax **qan-tər içində**. *Gəzirlər havalı ağalar, bəylər; Çalışır qan-tərdə naxırçı, nökər.* Aşıq Ələsgər. **Qan-tərə batmaq** – 1) çox tərləmək; 2) çox işləməkdən yorulmaq, əldən düşmək, çox çalışmaq. *Gözəldir bir uca əməl bəsləyib; Bu əməl uğrunda qan-tərə batmaq.* M.Müşfiq.

**QANTÖKƏN** *is.* Qatil, adam öldürən, cani. [Odabaşı:] *Hər bir cani, qantökən, yolkəsən ki divan əlindən qaçıb onun* [Əhməd ağanın] *evinə girməyi .. özünə mümkün elərdi, daha hər bir divan siyasətindən özünü* [azad] *hesab edərdi.* Ə.Haqverdiyev. *Qantökən öz tökdüyü qana cavab vermədi; Cavab vermək bir yana, "Yox, mən haqlıyam", – dedi.* B.Vahabzadə.

**QANUN[1]** *is.* [*ər.* əsli *yun.*] 1. İctimai və hüquqi münasibətlərin hər hansı bir sahəsini nizama salmaq üçün dövlət tərəfindən müəyyən edilən qərar, nizamnamə. *Seçki qanunu. Əmək haqqında qanunlar. Cəza qanunu. Qanun üzrə hərəkət etmək. Qanunu pozanlar məsuliyyətə cəlb olunurlar. Vergi haqqında qanun.* □ **Qanun xaricində** *rəs. hüq.* – qanunların himayə və mühafizəsi xaricində. **Qanuna salmaq** – bir şeyə qanuni, rəsmi bir şəkil vermək. **Qanuni-əsasi** *köhn.* – əsas qanun, konstitusiya. [Mehman] *qanuni-əsasidən başlayaraq .. vətəndaşlara verilən böyük hüquqlardan danışdı.* S.Rəhimov. // Ciddi əmr, hökm, buyuruq. *Şad olmayın, ey sevgili millət vükəlasi; Osmanlıda cari ola qanuni-əsasi!* M.Ə.Sabir.

2. Hamı üçün məcburi olan üsul, nizam, qayda. *Əxlaq qanunları. İmla qanunları.*

3. Obyektiv aləmin hadisələri arasında müəyyən qaydada təzahür edən zəruri əlaqə və qarşılıqlı asılılıq, səbəb və nəticə arasında mövcud olan daxili əlaqə. *İctimai inkişaf qanunları. Təbiət qanunları. Təfəkkür qanunu. – Amma təbiət öz qanununu əvvəl-axır yeritdi.* C.Məmmədquluzadə.

**QANUN[2]** *is.* [*ər.*] Yaxın və Orta Şərq ölkələrində geniş yayılmış uzunsov dördbucaq taxta üzərində gərilmiş simlərdən ibarət musiqi aləti.

**QANUNAUYĞUN** *sif.* Qanuna müvafiq, qanun ilə düz gələn; təsadüfi deyil, obyektiv qanun üzrə əmələ gələn, qanuna tabe olan. *Qanunauyğun hərəkət. Hadisələrin qanunauyğun* (z.) *inkişaf etməsi.*

**QANUNAUYĞUNLUQ** *is.* Hadisələr arasında mövcud olan zəruri əlaqə, obyektiv qanunlardan asılılıq. *Hadisələrin qanunauyğunluğu. İnkişafın qanunauyğunluqları.*

**QANUNÇU** *is.* bax **qanunşünas**.

**QANUNÇULUQ** *is.* 1. Bax **qanunşünaslıq**. 2. Bax **qanuniyyət** 2-ci mənada.

**QANUNƏN** *zərf* [*ər.*] Qanuna uyğun olaraq, qanun üzrə, qanuna görə. *Qanunən rəftar etmək. Qanunən düz deyil. – Şərqi öyrətmək qanun mucibincə lazım olduğunu bütün müəllimlər bilir. Hərçənd ki, qanunən şərqi müəllimi mütəxəssisi bir zat olsa gərəkdir.* A.Səhhət.

**QANUNİ** *sif.* [*ər.*] Qanuna müvafiq, qanuna uyğun, qanuna əsaslanan, qanunun yol verdiyi. *Qanuni rəftar. Qanuni hərəkət. Qanuni iş. Qanuni tələb.*

**QANUNİLƏŞDİRİLMƏ** "Qanunıləşdirilmək"dən *f.is.*

**QANUNİLƏŞDİRİLMƏK** *məch.* Qanuna uyğunlaşdırılmaq, qanuna müvafiq bir hala

salınmaq, qanuni şəklə salınmaq, qanuni qüvvə verilmək.

**QANUNİLƏŞDİRMƏ** "Qanunilәşdirmәk"-dәn *f.is.*

**QANUNİLƏŞDİRMƏK** *f.* Qanuna uyğun bir hala salmaq, qanuni şәklә salmaq, qanun qüvvәsi vermәk.

**QANUNİLİK** *is.* Qanuna uyğunluq, qanuna müvafiqlik. *Mәhkәmә hökmünün qanuniliyi.*

**QANUNİYYƏT** *is.* [*әr.*] 1. Qanunilik, qanuna uyğunluq, qanuni olma.

2. İctimai hәyat vә fәaliyyәtin qanunlarla tәmin olunduğu vәziyyәt.

**QANUN-QAYDA** b a x **qayda-qanun**. *Dәyişir sonunu hәr şey, diqqәt et; Dәyişir adәtlәr, qanun-qaydalar.* B.Vahabzadә.

**QANUNLAŞDIRILMA** "Qanunlaşdırılmaq"dan *f.is.*

**QANUNLAŞDIRILMAQ** b a x **qanunilәşdirilmәk**.

**QANUNLAŞDIRMA** "Qanunlaşdırmaq"-dan *f.is.*

**QANUNLAŞDIRMAQ** b a x **qanunilәşdirmәk**.

**QANUNNAMƏ** *is.* [*әr.* qanun vә *fars.* namә] Qanunlar mәcәllәsi (kitabçası), qanunlar toplusu, qanunlar toplanmış kitabça. // Qanun, qanun layihәsi. *Qәzetlәr yazırlar ki, duma vәzirin qanunnamәsini tәsdiq elәyir.* C.Mәmmәdquluzadә. [Əsgәr bәy Firidun bәyә:] *Yaxşı, yaxşı, otur yerindә. İndi, yoldaşlar, mәn istәyirәm sizinlә bizim bina qoyduğumuz cәmiyyәtin qanunnamәsi vә onun mәdaxil yolları barәsindә söhbәt edim.* Ə.Haqverdiyev.

**QANUNPƏRƏST** *sif.* vә *is.* [*әr.* qanun vә *fars.* ...pәrәst] Qanuna ciddi riayәt edәn, qanundan kәnar çıxmayan.

**QANUNPƏRƏSTLİK** *is.* Qanuna ciddi surәtdә riayәt etmә, qanundan kәnar çıxmama.

**QANUNSUZ** *sif.* Qeyri-qanuni, qanuna zidd, qanuna müvafiq olmayan, qanunu pozan. *Qanunsuz hәrәkәt. Qanunsuz* (z.) *iş görmәk. – Mәn ondan qanunsuz taxta alanda; Bilәydim, bu gündәn mәnimçün dә var!* B.Vahabzadә.

**QANUNSUZLUQ** *is.* 1. Qeyri-qanunilik, qanuna uyğun olmama, qanuna zidd olma; qanunsuz hәrәkәt.

2. Nizamsızlıq, şuluqluq, başlı-başınalıq, hәrc-mәrclik. [Nizami:] *Minlәrcә azәrbaycanlını qamçı vә ağac gücünә sәfәrbәrliyә alaraq tәzә Atabәyә malikanә düzәltmәk, kәndlәr, bazarlar tikmәk qanunsuzluq, zülm vә insafsızlıqdır ki, bunu da xalqa anlatmaq lazımdır.* M.S.Ordubadi.

**QANUNŞÜNAS** *is.* [*әr.* qanun vә *fars.* ...şünas] 1. Qanunları yaxşı bilәn, qanunlar mütәxәssisi; hüquqşünas.

2. Qanunlara, nizam vә qaydalara dәqiq surәtdә riayәt edәn, onları lazımınca yerinә yetirәn (adam).

**QANUNŞÜNASLIQ** *is.* 1. Hökumәt qanunlarını yaxşı bilmә; hüquqşünaslıq.

2. Qanunlara, nizam vә qaydalara tabe olma, onları lazımınca yerinә yetirmә.

**QANUNVERİCİ** *sif.* Qanun verәn, qanun vermәyә ixtiyarı olan. *Qanunverici orqan.*

**QANUNVERİCİLİK** *is.* Qanun vermә işi. *Qanunvericilik hakimiyyәti.*

**QAN-YAŞ** *is.* Göz yaşı, ağlama, yas. □ **Qan-yaş axıtmaq (tökmәk)** – çox ağlamaq, çox kәdәrli olmaq, çox tәәssüflәnmәk, yasa batmaq. *Parlaq günәşim, hәsrәti-ruyinlә gözümdәn; Qan-yaş axıdıb Dәclәlәr icad edәrәm mәn.* Heyran xanım. *Qoymayın ki, qan-yaş töküb ağlasın; Bu yaralı ana vәtәn, durnalar!* S.Rüstәm. // Müsibәt çәkmәk, ağır, mәşәqqәtli hәyat keçirmәk, zülm çәkmәk. *Bәylik olan zamanda; Bizim Azәrbaycanda; Qan-yaş tökәn çox imiş; Dadә yetәn yox imiş.* H.K.Sanılı. **Qan-yaş içindә olmaq** – ağlamaq, yasa batmaq, yaslı olmaq.

**QAPADILMA** "Qapadılmaq"dan *f.is.*

**QAPADILMAQ** *mәch.* 1. Qapağı örtülmәk, ağzı qapaqla qapanmaq.

2. Bağlanmaq, örtülmәk, qıfıllanmaq. *Qapı qapadıldı.*

3. Örtülmәk, qaplanmaq. *Demәk olar ki, bütün dağ, daş, dәrә hamısı qarla, dumanla qapadılmış vә tutulmuşdu.* S.Rәhimov.

**QAPAĞAN** *sif.* b a x **qapan**$^2$.

**QAPAQ** *is.* 1. Hәr hansı bir şeyin (qabın vә s.-nin) üstünü örtәn hissәsi. *Sandıq qapağı. Qutu qapağı. Çaynikin qapağı.*

2. Bәzi bәdәn üzvlәrini örtәn pәrdә. *Göz qapağı. Diz qapağı. – Qoca göz qapaqlarını ağır-ağır qaldırdı.* İ.Əfәndiyev.

**QAPAQAP** *is.* Bir-birinin əlindən, hərə bir tərəfdən dartışdırma, bir-birinin əlindən qapma; qapışdırma. [Səfər bəy:] *Qapaqap yavıqlaşanda, yaraq-əsbab bilmirsən ki haradan tapıldı?* M.F.Axundzadə. ☐ **Qapaqap düşmək** – bir-birinin əlindən qapmaq, hərə bir tərəfdən qapışdırmaq.

**QAPAQCIQ** *is.* Kiçik qapaq.

**QAPAQLAMA** "Qapaqlamaq"dan *f.is.*

**QAPAQLAMAQ** *f.* Qapağını örtmək, qapağını bağlamaq, qapağını qoyub bərkitmək, üstünə qapaq qoymaq. *Samovarı qapaqlamaq. Qazanı qapaqlamaq.*

**QAPAQLANMA** "Qapaqlanmaq"dan *f.is.*

**QAPAQLANMAQ** *məch.* Qapaqla örtülmək, qapağı bağlanmaq, bərkidilmək.

**QAPAQLATMAQ** *icb.* Qapaqla örtdürmək, bağlatmaq, üstünə qapaq qoydurmaq.

**QAPAQLI** *sif.* Qapağı olan, qapaqla örtülü, qapaqla bağlı olan. *Qapaqlı qazan. Qapaqlı çaydan. Qapaqlı qənddan.*

**QAPAQLIQ** *is.* Qapağa yararlı, qapaq qayrıla bilən hər şey. // Qapaq vəzifəsini görən şey.

**QAPAQSIZ** *sif.* Qapağı olmayan, üstü örtülməyən. *Qapaqsız qazan. Qapaqsız qəhvədan. Qapaqsız qutu.*

**QAPALI** *sif.* 1. Qapanmış, bağlı; qapısı və ya qapağı örtülmüş. *Qapalı ev. Qapalı qutu. Qapalı qapı. – Küçə dükanlarından başqa hər yer qapalı idi.* M.S.Ordubadi. [Sübhanverdizadə] *ağzı qapalı qablara baxdı və yaxınlaşıb qapaqları bir-bir qaldırdı.* S.Rəhimov.

2. Örtülü. *Qapalı göz. – Qapalı ağıza milçək girməz.* (Ata. sözü). *İşıqsız, qapalı bir göz, de, gözmü?..* B.Vahabzadə.

3. İşlək olmayan, qabağına sədd çəkilmiş, bağlı. *Qapalı yol.*

4. Ucları, kənarları birləşdirilmiş. *Qapalı xətt. Qapalı səth.*

5. *məc.* Kənar adamların girməsinə, iştirak etməsinə, istifadəsinə, bilməsinə icazə verilməyən; gizli. *Qapalı iclas. Qapalı məktəb. Qapalı məktub.*

6. Cəmiyyətdən ayrılmış, təcrid olunmuş; yalnız öz məhdud mənafeyi ilə məşğul. *Qapalı həyat. Qapalı mühit.* // Ünsiyyətsiz, adamdan qaçan, ürəyini heç kəsə açmayan. *Qapalı adam.*

**QAPALILIQ** *is.* 1. Qapalı şeyin halı.

2. Qapalı (6-cı mənada) adamın xasiyyəti. *Təbiətimdəki qapalılığa rəğmən, o gənc qadın haqqında sənə heç nə söyləmədim.* İ.Əfəndiyev.

3. Gizlilik.

**QAPAMA** "Qapamaq"dan *f.is.*

**QAPAMAQ** *f.* 1. Bağlamaq, örtmək. *Sandığı qapamaq. Yeşiyi qapamaq.* // Bağlamaq, qıfıl və s. ilə bağlamaq. *Qapını qapamaq. Pəncərəni qapamaq.* // Açıq şeyi örtmək. *Ağzını qapamaq. Kirpiklərini qapamaq. – Göz yaşı Bəyimi boğdu. Əlləri ilə gözlərini qapayıb hönkürdü.* Çəmənzəminli. *Birdən kimin əlləri isə arxadan Aynanın gözlərini qapadı.* Ə.Məmmədxanlı.

2. Örtmək, keçilməz hala salmaq. *Dərələrin sel oyan yerlərindən başlamış ta sinələrinə qədər seyrək tikan kolları qapamışdı.* S.Rəhimov.

3. Üstünə pərdə, örtü və s. çəkmək; gizlətmək, görünməz hala salmaq. [Gəlin] *bir də məclisin ortasında duruxub, əlləri ilə üzünü qapadı.* Çəmənzəminli. *Üzüldü əlləri sükandan, aman; Qapadı hər şeyi qatı bir duman.* M.Rahim.

4. Deşiyi tutmaq, tıxamaq, kip bağlamaq. *Şüşənin* (*quyunun*) *ağzını qapamaq.*

5. Uclarını, kənarlarını, son nöqtələrini birləşdirmək. *Dairəni qapamaq.*

6. Bağlamaq, bitirmək, fəaliyyətini dayandırmaq. *İclası qapamaq.*

**QAPAN[1]** *is.* Ağır şeyləri çəkmək üçün böyük tərəzi. *Güləlioğlu böyük kooperativ qapanını arabaya qoyub anbarın çardağına gətirirdi.* M.Hüseyn. *Çağır tərəzini, çağır qapanı; Çağır çağrışlarla şöhrət tapanı.* M.Araz.

**QAPAN[2]** *f.sif.* Dişləyən, tutan, sərt. *Qapan at. – Qapan it dişini göstərməz.* (Ata. sözü).

**QAPANÇI** *is.* Qapana baxan, qapanda şey çəkən adam.

**QAPANÇILIQ** *is.* Qapançı vəzifəsi, peşəsi.

**QAPANDAR** bax **qapançı**. *Qapandar yığılmış pambığı qapanda çəkdi.*

**QAPANDARLIQ** bax **qapançılıq**.

**QAPANMA** "Qapanmaq"dan *f.is.*

**QAPANMAQ** *f.* 1. Bağlanmaq, kilidlənmək. *Pəncərələrin hamısı qapanmışdır. – Qapılar örtülüb qapanmışdır.* A.Səhhət.

2. Örtülmək (açıq şey haqqında). *Elə bil düşdüyü bəlanı qanır; Yenidən gözləri yenə qapanır*. A.Səhhət.

3. Buludla örtülmək, tutulmaq, çulğalanmaq. *Hava soyudu, göyün hər tərəfi qapandı*.

4. Tıxanmaq, kip bağlanmaq, tutulmaq. *Şüşənin ağzı qapanmışdır. Qapı-pəncərə yaman qapanmışdır, nəfəs almaq olmur.*

5. Ucları, kənarları, son nöqtələri birləşdirilmək (məftilin, zəncirin və s.-nin).

6. Bitirilmək, dayandırılmaq, bağlanmaq. *İclas axşam saat 10-da qapandı.*

7. Rəsmən ləğv edilmək, qadağan edilmək; işləməsinə, fəaliyyətinə, çıxmasına icazə verilməmək, bağlanmaq. *Bəşir cənabları elə bilir ki, Balaxanıdakı qız məktəbi qapandı, amma qeyri şəhərlərdə neçə-neçə qız məktəbləri var.* C.Məmmədquluzadə. *Bu fitva çıxandan bir neçə gün sonra* [Təbrizdə] *kinoteatrların bir neçəsi qapandı.* M.S.Ordubadi.

8. Bayıra çıxmamaq, içəridə oturub qalmaq. *Otaqların kirayəsini və əmək xərcini axşamdan verib otağımıza qapandıq.* M.S.Ordubadi. *Yarım saat çəkmədi, aralıqda beş-on köynək cırıldı və Hürzad tərəf döyülmüş, söyülmüş geri çəkilib evdə qapandılar*. Çəmənzəminli. *Axşamları quşlar və böcəklər ilə bərabər insanlar da daxmalarına qapanır, qəsəbəni dərin bir sükut bürüyürdü*. H.Nəzərli. // Sıxınmaq. [Durna] *da bu balaca qulan kimi anasının səsini eşidəndə qaçıb dizlərinə qapanardı.* İ.Əfəndiyev.

9. Yıxılmaq. *Əmrah ağzı üstə qapandı, yalnız ikicə dəfə hönkürdü*. M.Hüseyn.

10. Haqq-hesab kəsilmək, tamamlanmaq, ləğv edilmək. *Keçənilki mühasibat dəftərləri qapandı*.

**QAPAN-TƏRƏZİ** b a x **qapan**[1].

**QAPATMA** "Qapatmaq"dan *f.is.*

**QAPATMAQ** *icb.* Qapamağa, örtməyə, bağlamağa məcbur etmək.

**QAPAYICI** 1. *sif.* Qapayan, örtən. *İlbizlərin bədəninin qapayıcı əzələləri.*

2. *is.* Dəstədə, sırada ən axırıncı gedən şəxs.

**QAPAZ** *is.* 1. Əl ayası ilə başa vurma. *Amma burada yenə bir az fikirləşirəm, fikirləşirəm ki, Hacı əmi müxbirin başına qapazı nə üçün ilişdirirdi*. M.Ə.Sabir. *Qoy nağıl eləyim, sənin haqqında olmasa, durub mənim başıma bir qapaz vur*. M.S.Ordubadi. *Doğrudur, Mahmud arvadını çox sevirdi, .. amma bununla belə daima aldığı qapazlardan çox da məmnun olmazdı*. B.Talıblı. ☐ **Qapaz vurmaq (salmaq)** – əl ayası ilə birinin başına vurmaq. *Gör yağı oğurlayıb harasında gizləyib, – deyə* [anası] *Xanməmmədin başına bir cüt qapaz saldı*. Çəmənzəminli.

2. *məc.* Zülm, təhqir mənasında. *Ona ümid, mənə zor, amma demir kimə haqq? Əl-ayaq zəncirdədir, baş qapazlı, sinə dağ.* B.Vahabzadə.

**QAPAZALTI** *is. dan*. Hər kəs tərəfindən təhqir olunan, incidilən aciz, məzlum, hüquqsuz adam.

**QAPAZLAMA** "Qapazlamaq"dan *f.is.*

**QAPAZLAMAQ** *f. dan*. Qapazla vurmaq, başına vurmaq. [Şahqulu:] *Siz öləsiz, özü məni gündə min qapazlayır.* N.Vəzirov.

**QAPAZLANMA** "Qapazlanmaq"dan *f.is.*

**QAPAZLANMAQ** *məch.* Qapazla vurulmaq.

**QAPAZLAŞMA** "Qapazlaşmaq"dan *f.is.*

**QAPAZLAŞMAQ** *qarş. dan.* Bir-birini qapazla vurmaq.

**QAPÇAQ** *is.* 1. Taxtadan qayrılmış su və ya şərab qabı; çəllək. *Qapçaq su ilə doludur*.

2. Cod həsirdən, kəndirdən toxunmuş, ya tikilmiş böyük kisə. *Bir qapçaq kartof.*

**QAPDIRMA** "Qapdırmaq"dan *f.is.*

**QAPDIRMAQ** 1. *icb.* Qapmağa təhrik etmək, qapmağa məcbur etmək. *İti qısqırdıb yoldan keçəni qapdırırdı.*

2. *f.* Qapışdırmaq, qapıb almaq, oğurlamaq. *Boş danışma, bura say qapdırıb aldıqlarını*! M.Ə.Sabir.

**QAPI** *is.* 1. Girib-çıxmaq üçün evin, yaxud barının və s.-nin divarında açıq yer, deşik, habelə bu deşiyi qapamaq üçün taxtadan, dəmirdən və s.-dən düzəldilən qurğu. *Divara qapı açmaq. Ev qapısı. Qapını örtmək. Ara qapı* (iki otağın arasındakı qapı). *Qapı ağzı* (qapının qabağı, qapı önü). *Qapı içi* (*astana*). // *məc.* Ev mənasında. [Gülzar:] *Heç kəs cürət edib bu qapıya gələ bilməz.* S.S.Axundov.

2. Evin, binanın qabağı, girəcəyi; həyət. *Elə kəs var ki, tapılmaz qapısında bir inək*. S.Ə.Şirvani. *Mal qapıya gələndə axşam-*

*səhər; Qoyun mələr, quzu mələr, dağ mələr.* A.Şaiq. *Hədiyyə naharını təzəcə bitirmişdi ki, qapıda maşın səsləndi.* Mir Cəlal. □ **Qapıbaca** – ev, həyət, evin yan-yörəsi. *Qapıbacadan muğayat ol. İt qapı-bacanı qoruyur.* – [Xırda xanım:] *Bu saat otaqları təmiz süpürərsən, qapı-bacanı gül kimi eləyərsən.* N.Vəzirov. *Züleyxa xeyli vaxt, həyəcan içində qapı-bacada dolandı.* S.Rəhimov. **Qapıda törəmə** – sahibinin öz həyətində doğulmuş və ya böyümüş (heyvan haqqında). // Evin divarları, evə yapışıq olan yerlər. *Qapıbacanı əhənglə ağartmaq .. ümumi bir həvəs idi.* H.Sarabski.

3. Bir şeyin ağzını, deşiyini, girəcəyini örtüb bağlamaq üçün dəmirdən, taxtadan, şüşədən və s.-dən düzəldilmiş örtü. *Şkafın qapıları. Buxarının qapısı. Avtomobilin qapısı.*

4. Nərd oyununda: iki daşla tutulan xana.

◊ **Açıq qapı** – hər kəsin girə bildiyi yer. *..Qaçay arxasını divara söykəyib açıq qapıdan həyətə baxırdı.* İ.Məlikzadə. [Əmir:] *Mən bağlı qapını yox, açıq qapını kilidləməklə qapını bir az açıq qoymuşdum.* M.S.Ordubadi. **Bağlı qapı dalında** – gizli, xəlvəti, kənar adamın iştirakı olmadan. **Qapı dalında qalmaq (qoymaq)** – 1) bayırda qalmaq, içəri buraxılmamaq; 2) sıxıntıda qalmaq, çətinliyə düşmək, ağır vəziyyətə düçar olmaq. *Bəs ana deyilmi, özün söylə bir; O qapı dalında qoyduğun ana?* B.Vahabzadə. **Qapıda durmaq** – müntəzir olmaq, gözləmək. [Mirzə Cəfər xan:] *Əli xan .. indi, budur, özü də, sərkərdələri də gəlib qapıda durub, hüzuri-aliyə müşərrəf olmağa izin istəyirlər.* Ə.Haqverdiyev. **Qapıdan qovmaq** – rədd etmək, qəbul etməmək, üz göstərməmək. [Dərviş:] *Ay camaat, Allah xatirinə, gəliniz məni bu zalımın əlindən xilas ediniz. Qardaş, köməyə gələn olmadı. Yüyürdüm divan qapısına,* "*bizə dəxli iş deyil*" *– deyib, məni qapıdan qovdular.* N.Vəzirov. **Qapı-qapı gəzmək (dolaşmaq, düşmək)** – 1) hər tərəfə müraciət etmək, hər tərəfi dolanmaq, həyətbəhəyət gəzmək (bir şey üçün). [Yasəmənin] *əri Yusif də qapı-qapı gəzib ayı oynadardı.* S.S.Axundov. *Yazırsınız ki, sudan ötrü qapı-qapı dilənirsiniz və bundan savayı çox artıq-əskik sözlər yazırsınız.* "Mol. Nəsr." *Qadınlar belə adamı qapı-qapı axtarıb tapırlar.* M.S.Ordubadi. *Qoca Məşədi Məmmədvəli qapı-qapı düşüb bəylərə, mollalara yalvarıb bir neçə günün müddətində həmin kağızı düzəltdi.* Ə.Haqverdiyev; 2) dilənmək, dilənçilik etmək. *Həyat qayğısı, ehtiyac ananı qapı-qapı gəzdirdi.* Mir Cəlal. **Qapı-qapıya** – lap yaxın, üz-üzə. *Qapı-qapıya qonşular.* – [Dükançı Hümmətəli:] *Bəy, məni tanımırsan? Bahalıq ili siz ilə qapı-qapıya olmurduqmu?* Ü.Hacıbəyov. **Qapılara düşmək** – qapı-qapı gəzib dilənmək, dilənçilik etmək. [Qurban Pəri caduya:] *Niyə dövlətli adamları tovlayıb puldan-zaddan almırsan, çiyninə bir torba salıb qapılara düşürsən?* Ə.Haqverdiyev. **Qapını dabanından çıxarmaq** – gedib-gəlməklə birini təngə gətirmək, bir yerə, bir adamın yanına çox gəlib-getmək, israr etmək. [Oğlanlar] *qapını döydülər. Açmadı. Yumruqla döyəclədilər, hətta təpiklə taqqıldatdılar. Qız qapının az qala dabanından çıxacağını görüb qorxdu.* İ.Şıxlı. **Qapını döymək** *məc.* – lap yaxınlaşmaq. *Qış qapını döyür. – Axı, cəsarətsiz, axı, ürəksiz; Qapını döyməmiş hələ bir zəfər.* B.Vahabzadə. **Qapını üzünə çırpmaq** – çox pis qarşılamaq, qəbul etməmək, qovmaq. **Qapısı açıq** – qonaqpərəst, comərd, səxavətli, çörək verən adam haqqında. *Qapısı açıq adamdır. – Ürəyi, süfrəsi, qapısı açıq; Kimsə bu qapıdan sənə deməz, çıx.* Şəhriyar. **Qapısı bağlanmaq (çırpılmaq)** *məc.* – evi-eşiyi dağılmaq, ailəsi məhv olmaq. *Çatmadı əvvəlcə bu xəbər ona; İnana bilmədi qulaqlarına; Elə ki, inandı... o, lal kəsildi; .. Anladı, bildi: Qapısı bağlandı, ocağı söndü.* B.Vahabzadə. **Qapısını döymək** *məc.* – sataşmaq, dolaşmaq. *Quduz düşmən, özünü bir bu qədər öymə, gəl; Bu qartallar yurdunun qapısını döymə, gəl.* S.Rüstəm. *Döymə qapımı, döyməyim qapını.* (Məsəl). **Qapısının açarı dama atılmaq** – b a x **qapısı bağlanmaq**.

**QAPIBİR** *sif.* Çox yaxın, lap yaxın, qapı-qapıya. *Qapıbir qonşu. – Yoxsa həqiqətdə bizim südümüzün bərəkəti həmin qapıbir qonşularımızın pambığının bərəkətinə bağlıdır.* C.Məmmədquluzadə. *Lətifəgilin qapıbir qonşusu mühəndis Tapdıqov daldan gəlir, qızların söhbətini aydın eşidirdi.* M.Hüseyn.

**QAPICIQ** *is.* Kiçik qapı.

**QAPIÇI** *is.* 1. Binanın qapısında durub gözətçilik edən xidmətçi. *Klub ağzında duran qapıçı qorxub divar dibinə çəkildi.* A.Şaiq. *Məhbusi hələ bu vaxta qədər orada qoca qapıçıdan başqa bir ins-cinsə rast gəlməmişdi.* M.İbrahimov.

2. *idm.* Futbol, xokkey oyunlarında: qapını müdafiə edən oyunçu. *"Neftçi"nin qapıçısı.*

**QAPIÇILIQ** *is.* Qapıçının işi, vəzifəsi. [Sadıq kişi:] *A kişi, Allah sənə qapıçılıqdan artıq qulluq qismət eləməsin, qırarsan xalqı!* Mir Cəlal.

**QAPILMA** "Qapılmaq"dan *f.is.*

**QAPILMAQ[1]** "Qapmaq"dan *məch. Əlindən qapılmaq. Papağı başından qapıldı.*

**QAPILMAQ[2]** *t-siz.* Bir şeyə həddindən artıq aludə olmaq, uymaq, bütün fikrini, özünü tamamilə bir şeyə həsr etmək. *Elmə qapılmaq. Kitaba qapılmaq. – Lakin Tütünçüoğlu, gənc olduğuna baxmayaraq, başqaları kimi həlli müşkül olan arzulara qapılmazdı.* M.S.Ordubadi. *..Lakin buna baxmayaraq, o hər an hissə qapılmayacağına söz verir.* M.Hüseyn. // Bir şeyə həddən artıq başı qızışaraq, başqa şeyləri unudub, yalnız onun haqqında düşünmək. *Hər gün qapılır bir yeni xülyaya bizim qız!* Ə.Nəzmi. [Kərimxan] *bütün varlığı ilə başladıqları işin şövqünə qapılmışdı.* M.İbrahimov.

**QAPISIZ** *sif.* Qapısı olmayan. *Qapısız və gecələr işsiz olan hücrələrin döşənəkləri çürük həsir qırıqlarından ibarətdi.* Ə.Məmmədxanlı.

**QAPIŞDIRILMAQ** *məch.* Tez-tələsik götürülmək, bir-birinin əlindən qapılıb alınmaq, dartışdırılmaq.

**QAPIŞDIRMA** "Qapışdırmaq"dan *f.is.*

**QAPIŞDIRMAQ** *f.* 1. Tez-tez, tələsik götürmək, bir-birinin əlindən qapıb almaq, dartışdırmaq.

2. Çırpışdırmaq, oradan-buradan götürmək.

3. *icb.* İtləri bir-birinin üzərinə saldırmaq, boğuşdurmaq.

**QAPIŞ-QUPUŞ** *is. dan.* Hərə bir yandan tez, tələsik götürmə, qapışdırma, bir-birinin əlindən qapıb alma, dartışdırma. ☐ **Qapış-qupuş etmək** – qapışdırmaq. *Alaçiy bişən əti adamlar tüstülü-tüstülü, alovlu-alovlu qapış-qupuş elədi.* S.Rəhimov.

**QAPIŞMA** "Qapışmaq"dan *f.is.*

**QAPIŞMAQ** *qarş.* Bir-birini qapmaq, bir-birini dişləmək; boğuşmaq.

**QAPQARA** *sif.* Tünd qara, zil qara. *Qapqara kömür. Qapqara saç. Qapqara rəng.* – [Südabənin] *qapqara gözləri yenə şam kimi yandı.* M.İbrahimov. *Qapqara tüstülər qalxır yuxarı.* M.Rahim. ☐ **Qapqara qaralmaq** – tamamilə qara olmaq. *Kosanın qırışıq sifəti saralmış, dodaqları sallanmış, dişlərinin qurd yeyən yerləri qapqara qaralmışdı.* S.Rəhimov.

**QAPQARANLIQ** *sif.* Tamamilə qaranlıq, zülmət. *Qapqaranlıq gecə.*

**QAPLAMA** 1. "Qaplamaq"dan *f.is.*

2. *is.* Metal və s. üzərinə çəkilən təbəqə.

**QAPLAMAÇI** *is.* Metal və s. üzərinə qızıldan, gümüşdən və s.-dən təbəqə çəkən usta.

**QAPLAMAQ** *f.* Hər tərəfini əhatə etmək, bürümək, çulğamaq, örtmək, basmaq, tutmaq. *Duman ətrafı qapladı. – Zülmət yenə qaplamış cahanı; Yox nuri-həyatdan əlamət.* A.Səhhət. *Buludlar bir-birinin üzərinə yığılmış, ortalığı dərin bir zülmət qaplamışdı.* A.Şaiq. *Təntənəli bir sükut qaplamışdı otağı.* R.Rza.

**QAPLAN** *is. zool.* İsti ölkələrdə yaşayan, pişik cinsindən çox yırtıcı və çevik heyvan; benqal pişiyi, bəbir. [Şair:] *Qaplan yırtıcıların ən vəhşisidir, fəqət qaplanları parçalayacaq daha böyük vəhşilər var ki, o da insanlardır.* H.Cavid. *Hər kəs .. şaşqın bir həyəcan içində ikən, on beş yaşlarında bir oğlan bir qaplan çevikliyi ilə meydana atılıb düz buğanın üstünə cumdu.* M.Rzaquluzadə.

**QAPMA** "Qapmaq"dan *f.is.*

**QAPMAQ** *f.* 1. Birdən əlini uzadıb cəld götürmək, dartıb almaq, qamarlamaq. *Məhərrəm iynəni əlindən buraxıb bucaqdakı ağırbaşlı çəkici qaparaq qapını açıb kənara çıxdı.* H.Nəzərli. [Şagird qızın] *bu sözlərindən molla bacı elə acıdı ki, çubuğu qapıb qızı döyəcləməyə başladı.* Çəmənzəminli. // Götürmək, qaldırmaq. *..Qaçdım yerdəki daşlara tərəf və qabağıma gələn daşları yerdən qapıb, başladım Şirəliyə tərəf tullamağa.* C.Məmmədquluzadə. *Bir tikanlı ağac qapıb yerdən; Gözlədim qovğanın zəmanını mən.* A.Səhhət. [İmamverdi:] *Dəyənək davasıdır*

*məgər, qapım dəyənəyi, iyirmi soldatı xurd-xəşil edəm.* C.Cabbarlı. // Cəld tutmaq (atılan, yaxud uçan şeyi). *Səməd .. Mirkazımın atdığı qızılı göydəcə qaparaq, göy jiletinin kiçik cibinə yerləşdirdi.* S.Rəhimov. // Yapışmaq, yapışıb tutmaq. *Mən onu deyirəm ki, bu axır zamanda bir naxoşluq əmələ gəlibdir, adına "minengit" .. deyirlər, mərizlərin qapır peysərindən, peysər dönür bir oduna.* N.Vəzirov.

2. Çalmaq, oğurlamaq, aparmaq, götürüb qaçmaq. *Dedi: – Yorğan üçün imiş bu təlaş; Yorğanı qapdılar, kəsildi savaş.* M.Ə.Sabir.

3. Dişləmək, dişlərini batırıb yaralamaq. *İt uşağı qapdı.*

**QAPSAMAQ, QAPSIMAQ** *f. məh.* Zorla almaq, tutmaq, zəbt etmək. *Qapsayıblar yetimlərin obasın; Ev sahibin qovar zor olsa qonaq.* Q.Zakir.

**QAPSANMAQ, QAPSINMAQ** *f.* Qapanmaq, tıxanmaq, pərçim olmaq.

**QAR** *is.* Qışda müxtəlif şəkillərdə, ən çox ulduz şəklində yağan və hər tərəfi örtən donmuş ağappaq su kristalcıqları. *Qar yağır. Yumşaq qar. Sulu qar. Qar kimi ağ. Qar yığını.* – *Qar yerin yorğanıdır.* (Ata. sözü). *Göyün üzünü qar havasına məxsus bir tutqunluq bürümüş, şiddətli küləklə qar yağırdı.* S.Hüseyn. ◻ **Qar anbarı** – yayda işlənmək üçün qar saxlanılan yeraltı anbar. **Qar çovğunu** – bərk küləkli qar. *Dondum heyrət içində iki ay ərzində siz; Min fəryadı dinləyib bir ah da çəkmədiniz! Bakıda qar çovğunu... pəncərə buz, şüşə buz; Gözləriniz mavi buz.* X.Rza. **Qar kimi** – ağappaq, dümağ, süd kimi ağ. *Ağarmış saçları dağda qar kimi; Ürəkdə həsrəti, dərdi var kimi..* S.Vurğun. *Salatın isə geniş açılmış gözləri ilə qarşısındakı qocanın ay işığında qar kimi ağaran ağ saqqalına baxaraq, donub qalmış, sanki qızın nitqi tutulmuşdu.* Ə.Məmmədxanlı. **Qar olmaq** – ağarmaq. *Dağlar başı qar oldu; Bulud gəldi, tar oldu; Dünya mənim başıma; Nədən belə dar oldu?* (Bayatı). *Vaxtsız ayrılığa dözmədi qəlbi; Ağardı saqqalı, saçı qar oldu.* S.Vurğun. **Qar uçqunu** – uca dağlarda qar yığınının altı əridiyi zaman, birdən aşağıya doğru sürüşüb enən qar yığını. *Qarlı dağlar dumanlara bürünür; Parlayır, sislər içrə xoş görünür; Birdən ordan qar uçqunu uçdu; Bərk səs ilə guruldayıb düşdü.* A.Səhhət. **Əbədi qar** – uca dağların başındakı əriməyən qar.

**QARA**[1] 1. *sif.* Bütün rənglərin ən tündü, ən tutqunu; his, kömür rəngi (*ağ* ziddi). // *sif.* Bu rəngdə olan. *Qara boya. Qara saç. Qara at. Qara kostyum.* – [Musanın nəvəsi] *qara papağını qoydu, əlinin pəncəsi ilə bir az qabağa basdı.* Qantəmir. // *sif.* Çox tutqun (*açıq* ziddi). *Qara çörək.* – *Həmin gecə göy üzünü qara buludlar tutub, şiddətli yağmur yağmağa başlayır.* S.S.Axundov. *Salam .. qara torpaqdan bir xışma götürdü, baxdı.* Mir Cəlal. // Obrazlı təşbehlərdə: qaranlıq, tutqunluq (adətən tərkiblərdə işlənir). *Gecə qara pərdəsini götürdükdə Cavad yuxudan ayıldı.* Ə.Vəliyev. // Qaradərili, dərisinin rəngi qara olan. *Qara irq.* // İs. mənasında: cəm şəklində: **qaralar** – qara dərililər, qara irqə mənsub olanlar. *Anqola – qaralar ölkəsi, zəncilərin qədim torpağı; Odlar, alovlar içində yanır.* R.Rza.

2. İs. mənasında; cəm şəklində: **qaralar** – şahmat, dama oyunlarında qara rəngli fiqurlar, daşlar. *Qaralarla oynamaq.*

3. *sif.* Çirkli, kirli, tünd bir şeyə boyanmış, yaxud adi rənginə nisbətən daha tünd, daha tutqun. *Üz-gözü çirkdən qara olub. Kömürçünün qara əlləri. Böyürtkəndən dişlərim qara olmuşdur.*

4. *is.* Yazı, xətt, hərf. *Qara tanımaq. Qaraya baxmaq* (oxumaq). – *Ağlın aparıb, bəs ki baxır gündə qaraya.* M.Ə.Sabir. [Molla:] *Hə, hə, heç bilmirsiniz ki, onun üstündə mən nə zəhmət çəkmişəm, qaraları bir-bir ona tanıtmışam.* H.Sarabski.

5. *is.* Bir yazının qaralaması, ilk mətni, layihəsi. [Əbülhəsənbəy:] *İndi mənə de görüm, rusca yazdığın o intibahnamənin qarasını harada saxlayırsan?* M.S.Ordubadi. ◻ **Qarasını tökmək (yazmaq)** – ilk mətnin layihəsini yazmaq, tərtib etmək. *Onlara göndəriləcək məktubun qarasını töküb katibə verdikdən sonra, ancaq Maral evə qayıtdı.* Ə.Əbülhəsən.

6. *sif. məc.* Ağır, mənhus, pis, kədər doğuran, qəm gətirən, qorxulu. *Fərman bir yandan belə söyləyirdi, bir yandan da ürəyinə qara fikirlər gəlirdi.* Ə.Haqverdiyev.

[Məhərrəm] *sayıq idi. Pristavın və Səlim bəyin öz haqqında bəslədikləri nifrət və qara fikirləri bilirdi.* H.Nəzərli. // *məc.* Səfalətli, fərəhsiz, sevincsiz, talesiz, bədbəxt, faciəli. *Nə bəladır bizə, ya rəb, nə qara gündür bu?* Füzuli. [Pərzad:] *..Bayram, mənim dəxi bəxtəvər olmağım getdi; qara gün çox yaxınlaşıbdır.* M.F.Axundzadə. *Səbəb budur ki, orucluq söhbəti düşəndə mənim yadıma uşaqlığımın qara günləri düşür.* C.Məmmədquluzadə. // *məc.* Əziyyətli, məşəqqətli, çox ağır, mənhus. *Ruzigarım qara* (z.) *keçdiyin məgər; Söyləməyib zülfi-pərişan sənə?* Q.Zakir. *Qara qış üstümə tökər qarını; Nərgiz gözlərindən məni ayırsan.* M.Müşfiq. *Nəhayət, o qara qış çıxmış, yenə də yaz gəlmişdi*. Ə.Məmmədxanlı.

7. *sif. məc.* Cinayətkar, mənfur, mürtəce, fitnəkar. *İrticanın qara qüvvələri. – Biz ədibin* [Nərimanovun] *hər cür qara qüvvələrə, irticaya, zülmə, cəhalətə qarşı qəzəblə coşan qəlbini, nifrətlər yağdıran qələmini duyuruq*. M.Arif.

8. *is.* Yas, matəm mənasında. *Fələk qoymaz qaradan çıxsın ol sərvi-güləndamı*. S.Ə.Şirvani. *Könlüm yasdan çıxdı, qəlbim qaradan; Gülə-gülə bu həvəsdə xoş gəldin!* Aşıq Ələsgər. □ **Qara bayram** – bir şəxsin ölümünün ilk bayrama təsadüf etdiyi gün. **Qara geymək, qara bağlamaq** – yaslı olmaq, yas saxlamaq. *Qarə geydim, dağə batdım, saxlaram matəm hənuz*. S.Ə.Şirvani. *Bu gün Təbriz şəhəri iki böyük matəm üçün qara geyinmişdir.* M.S.Ordubadi. **Qara xəbər** – səfərdə olan bir adamın ölüm xəbəri. *Qara xəbər el-obanı dolandı; Əsgəranda Qoç Nəbini vurdular.* B.Vahabzadə. **Qara kağız** – ölüm xəbəri gətirən məktub. *Bu günlər qara kağızı gəldi qonşumuzun; Anasına oxuyanda kağızı; arvad birdən qocaldı; ağardı qaşları da.* R.Rza.

9. Qoşulduğu sözlərə mənfilik, mənhusluq, məşumluq mənası verir. *Qara qaygı. Qara dərd*. – [Mədinə] *şair, – dedi, – üzündən bir duman keçdi, qaş-qabağın bulud kimi sallandı... Canımı qara qeyd aldı... Amma axırı yaxşı oldu, üzünə yenə gün doğdu*. Çəmənzəminli.

10. *sif. köhn.* Cəmiyyətin yuxarı siniflərinə mənsub olmayan, istismar olunan; adi, avam. *Dəli Ozan qobuzunu çomaq kimi əlinə alıb .. bəylər cərgəsindən keçib qara camaatın içinə qarışdı.* M.Rzaquluzadə. [Əbdüləli bəy:] *Doğrudur, şəriət ancaq avam adamlar üçündür, qara camaat üçündür*. C.Cabbarlı. [Qədir] *özünü kütlədən, yəni qara camaatdan ayırmaq üçün həmişə hamı deyənin ziddinə getdi*. Mir Cəlal.

11. *sif.* Qədim Rusiyada: dövlətə məxsus olan, dövlətin ixtiyarında olan, öz xüsusi mülkiyyəti olmayan. *Dövlətə məxsus .. torpaqlarda yaşayan kəndlilərə* "*qara kəndlilər*" *və ya* "*qara xışlılar*" *deyirdilər*.

12. *sif. köhn.* İxtisası olmayan, ixtisas tələb etməyən, ağır işdə işləyən; adi. [Nadir] *haman yerdə 15 il irəli qara işçi idi*. B.Talıblı. [Bayram] *əvvəllər neft mədənində qara fəhlə idi*. M.Hüseyn.

13. *is.* Dəyərsizlik, əhəmiyyətsizlik, heçlik mənasında. [Hacı Bayram:] *Ərz elədim ki, bir qara qəpik də verməyəcəyəm.* Ə.Haqverdiyev.

14. *is.* Bəzi bitki və heyvan adlarının tərkib hissəsi kimi. *Qara darı. Qara istiot. Qara gavalı. Qara qarışqa*.

◊ **Qara basmaq** – qorxulu yuxu görmək, yaxud gözünə qorxulu şeylər görünmək, xəyalına qorxulu şeylər gəlmək, vahimə basmaq. *Məni qara basırdı. Sanki balkona baxan camların dalısında yüzlərcə adam durmuşdu.* M.S.Ordubadi. *Müəllim on yaşında sadə ürəkli və heç şeydən xəbəri olmayan bir uşağın sözünə inanmayaraq,* "*səni qara basıb*"*, – deyə cavab verdi.* B.Talıblı. **Qara bayraq çəkmək (açmaq)** – matəm əlaməti olaraq qara bayraq qaldırmaq, asmaq. *Ki nagah bir qara bayraq açıldı dar ağacında; Yazılmış onda bir xətti-müsibətzayi-hürriyyət.* M.Ə.Sabir. **Qara birja** – qeyri rəsmi, gizli birja. **Qara güruh** – ifrat irticaçı, talançı təşkilat və bu təşkilatın üzvləri. [Saran:] *O qara güruhun içində it yiyəsini tanımır.* M.Hüseyn. **Qara qarışqa kimi** – həddən çox, saysız-hesabsız. *Xalq qara qarışqa kimi küçələrdə gəzir.* **Qara qızıl** *məc.* – neft. *Qara qızıl çıxartdı yerin yeddi qatından;* "*Nədir bunun qiyməti?*" *sormadılar heç ondan.* B.Vahabzadə. **Qara pul** – mis pul. *Əvvəl gümüş idim sərraf əlində; Sərrafdan ayrıldım, qara pul oldum.* Molla

Cümə. [Kişi:] *Mən sənə hamam pulu verməkdən yoruldum, – deyə pul kisəsini çıxarır,* [iyirmi qəpik] *qara pul çıxardıb arvadına verərdi.* H.Sarabski. **Qara su** – 1) içməyə yaramayan, içməli olmayan sərt su. *Belə dayazdan çıxan suya kənd arasında "qara su" deyirlər. Hamınız bilirsiniz ki, qara su olan yerdən naxoşluq əskik olmaz.* Ə.Haqverdiyev; 2) *dan.* gözün tutulması ilə nəticələnən göz xəstəliyi. [Sona xanım:] *Mənim də gücüm öz canıma gəlir, başıma vurmaqdan az qalıb gözlərimə qara su ensin.* Ə.Haqverdiyev; 3) almaz və brilyantın qaramtıl şölə verən növü. **Qara vermək** – 1) özünü gözə çarpdırmaq, göstərmək, olduğunu hiss etdirmək. *Sən burada qara ver, mən bu saat gəlirəm. – Əvvəlcə onlardan bir nəfəri itlərə qara vermiş, iki nəfəri girəvələrdə dayanmış, .. xan da dərə yuxarı sürüyə sürünmüşdür.* S.Rəhimov; 2) özünü işləyən kimi göstərmək. **Qara yaxmaq** – böhtan atmaq, ləkələmək. *Əla oxuyan, hörmət qazanan bir tələbəyə nə ad qoyub, nə qara yaxasan?* Mir Cəlal. **Qara yuxu olmaq** – 1) bərk yuxulamaq, ayılmamaq; 2) ölmək.

**QARA²** *is.* Yer kürəsinin torpaqla örtülü hissəsi; torpaq (*su* qarşılığı). *Qarada və suda. Qara qüvvələri.*

**QARA³** *is.* Plov üzərinə, yanına qoyulan xuruş. *Aşın qarası azdır.*

**qara...** – bəzi mürəkkəb sözlərin birinci tərkib hissəsi; məs.: qarasaç, qaragöz, qaragün.

**QARAAĞIZ** *is. məh.* 1. Canavarın, qurdun ləqəbi.

2. Qoyun sürüsünün qabağına düşən erkək keçi, dıbır.

**QARAAYAQ** *sif.* Bədəni başqa rəng, ayaqları isə qara olan. *Qaraayaq at. Qaraayaq it.*

**QARAAZAR** *is. bayt.* Çox yoluxucu malqara azarı.

**QARABAQARA** *zərf* 1. İzincə, təqib edərək, ardınca düşərək, özünü göstərmədən, izləyərək. [Fərhad:] *Nə qarabaqara düşübsən, dalımca gəzirsən!* Ə.Haqverdiyev. [Xurşud:] *Yox, yox, vəzir qoşun götürüb qarabaqara onun dalınca getməlidir.* Ü.Hacıbəyov. *Heydər meşəyə gircək, onlar qarabaqara onu izlədilər.* S.Rəhimov.

2. Diqqətlə, hərf-hərf. *Qarabaqara oxumaq.*

**QARABASMA** *is.* Yuxuda görülən, yaxud xəyala gələn qorxunc şeylər; vahimə, kabus.

**QARABAŞ** *is. köhn.* Qulluqçu qadın (qız). *..Onun bacısı Səkinə xanım pəncərə qabağında durub qarabaşı Gülsəbanı çağırır.* M.F.Axundzadə. *Axırı Xudayar bəyin yazıq övrətə bir az rəhmi gəldi. Vəliqulunu özünə cütçü, Zibanı qarabaş tutdu ki, Zeynəbin işi bir az yüngülləşsin.* C.Məmmədquluzadə.

**QARABAŞAQ** *is. bot.* Toxumundan yarma, un hazırlanan tarla bitkisi. *Qarabaşaq və yulafda B vitamini vardır.*

**QARABAŞLIQ** *is. köhn.* Qulluq-çuluq, kənizlik.

**QARABATDAQ** *is. zool.* Balıqla qidalanan uzunboğaz, qısaayaq, cəld üzən su quşu.

**QARABƏXT** *sif.* Bəxtsiz, bədbəxt, talesiz. [Nadir] *özünün şəxsi həyatda qarabəxt olduğunu anladı.* B.Talıblı.

**QARABƏNİZ** *sif.* Qarabuğdayı, qaraşın. *Qarabəniz qız, oğlan. – Həqiqətdə bu qadınların heç birisi təbrizliyə bənzəmirdi. Bunlar qarabəniz, .. uzunsov çöhrəli qadınlardı.* M.S.Ordubadi.

**QARABIĞ(LI)** *sif.* Bığları qara. *Qarabığ kişi. – Sadədil muzdur indi anladı ki, uzunboylu, qarabığlı müsafir xozeyin deyilmiş, oğru imiş.* S.M.Qənizadə.

**QARABOĞAZ¹** *sif. dan.* Son dərəcə mütəəssib.

**QARABOĞAZ²** *is. zool.* Torağay cinsindən döşündə iri qara xal olan bir quş.

**QARABOĞMA** *is.* Difteritin xalq arasında adı.

**QARABUĞDA** *is. k.t.* Çovdar.

**QARABUĞDAYI** *sif.* Dərisinin rəngi buğdayı olan, qarabəniz. *Gülpəri qısaboylu, dolu əndamlı, qarabuğdayı bir qız idi.* S.S.Axundov. *Bəli, Tükəzban xala ortaboylu, ortayaşlı, qarabuğdayı, nə arıq, nə də kök bir kəndli arvadı idi.* B.Talıblı.

**QARACA¹** *sif.* 1. Qara rəngli, qaramtıl.

2. *məc.* Dəyərsiz, qiymətsiz mənasında. *O qaraca qəpiyə o qədər məhəbbətimiz var ki, qeyri işlər yadımıza düşməyir.* N.Vəzirov.

**QARACA²** *is. k.t.* 1. Dəni qara toz halına salan taxıl xəstəliyi.

2. Taxıl dənləri arasında olan yumru və xırda zərərli bitki dəni. *Bu taxılın qaracası çoxdur.*

**QARACALI** *sif.* İçində qaraca olan. *Qaracalı buğda.*

**QARAÇALA** *is. məh.* Qara neftlə dolu çuxur, ya quyu.

**QARAÇI** *is.* 1. Avropa, Asiya və Afrikada köçəri və yarımköçəri qruplar halında yaşayan və əslən hindistanlı olan bir xalq. *Qaraçı köçü. – Zəlzələdən iki gün qabaq bir dəstə qaraçı bu şəhərin kənarında çadır qurub düşmüşdü.* S.S.Axundov.

2. *məc. dan.* Qışqırıqçı, küy-kələkçi, həyasız mənasında.

3. *məc. dan.* Xəsis mənasında.

4. *məc.* Yolçu, dilənçi.

**QARAÇILIQ** *is.* 1. Qaraçı həyatı, qaraçı güzəranı, qaraçı məişəti.

2. *məc.* Qışqırıqçılıq, küy-kələkçilik; həyasızca qışqırıq salma, həyasızlıq. [Nəcəf bəy Nazlı xanıma:] *Qaraçılıq lazım deyil. Mən sənə dedim, aləm yığıla, üç qəpik verməyəcəyəm.* Ə.Haqverdiyev.

3. *məc.* Xəsislik.

4. *məc.* Yolçuluq, dilənçilik.

**QARAÇIRAQ** *is.* Qara neftlə yanan çıraq. *Tez gedib Şərəf xalanın evinə çatdım, gördüm evin içində bir qaraçıraq yanır.* H.Sarabski. *..Boş konserv qabına tüfəng yağı töküb, cındırdan fitil salmaqla düzəldilmiş qaraçıraq isə, tüstü qarışıq olsa da, işıqlandıra bilirdi.* Ə.Əbülhəsən.

**QARAÇÖHRƏ** *is. bot.* Neştər şəklində yarpaqları olan bir bitki. *Qaraçöhrənin yarpaqları ensiz neştər şəklində olub, iki cərgəyə düzülmüşdür.* M.Qasımov.

**QARAÇÖRƏKOTU** *is. bot.* Küncüt fəsiləsindən bir bitki olub, qara və ətirli tumu çörəyin üzünə səpilir.

**QARAÇÖYRÜKOTU** *is. bot.* Küncütə oxşar, bir qədər ətirli tum meyvə verən cənub bitkisi; itotu.

**QARADABAN** *sif. dan.* Uğursuz, bədşüküm, ağırayaq. [Gəlin:] *Elə Cahandar ağanın özü də sonradan, – qaradabansan, gələn kimi evimə qan saldın, – deyə mənim üstümə atılmazmı? Yox, mən qana bais ola bilmərəm.* İ.Şıxlı.

**QARADALAQ: qaradalaq etmək** – 1) çox qovaraq əldən salmaq, üzmək. *Bu vuruşmada Nəbi Haqverdi yüzbaşını qovub qaradalaq etdi.* "Qaçaq Nəbi"; 2) qorxudub bağrını yarmaq.

**QARADƏRİLİ** 1. *sif.* Dərisinin rəngi qara olan. *Qaradərili adam.*

2. İs. mənasında, cəm şəklində: **qaradərililər** – zəncilər.

**QARADIRNAQ(LI)** *sif.* Dırnaqlarının rəngi qara olan. *Xəzər sərkərdəsinin qaradırnaqlı atı insan qanına hərisdir.* M.Hüseyn.

**QARADİNMƏZ** *sif.* Daima susan, laldinməz, danışmaz. *Qaradinməz adam. – Təbiətən qaradinməz* (z.) *və qaşqabaqlı olan Rüstəm uzaqdan Rza Qəhrəmanini görən kimi başını tərpətdi.* M.İbrahimov. *Xəlil əslində qaradinməz adam idi.* Mir Cəlal. *Usta qaradinməz bir kişi idi, haraya isə tələsirdi.* Ə.Sadıq. // İs. mənasında. *Rəhim bəy dedi: – Uşaq tayfası Ağca xanım kimi oynamağa, gülməyə yaranmışdır.. Yoxsa mənim qızım kimi qaradinməzdən nə fayda?* S.S.Axundov.

**QARADİNMƏZCƏ** *zərf* Susmuş halda, küsmüş kimi. [Süleyman:] *Balam, nə olub ki, belə qaradinməzcə oturubsan, yoxsa dünyanın dərdi sənə qalıbdır?* Ü.Hacıbəyov.

**QARADİNMƏZLİK** *is.* Qaradinməz adamın xasiyyəti; danışmamazlıq. *Azadda Cumanınkına oxşayan xasiyyət onun qaradinməzliyi idi.* Ə.Əbülhəsən.

**QARADOVOY** b a x **qorodovoy**. *Sərvər fit çalır, qaradovoy çağırır. Qoçular həmən saat qoyub qaçırlar.* Ü.Hacıbəyov.

**QARADÖŞLÜ** *sif.* Döşü qara olan. *Qaradöşlü toyuq.*

**QARADUVAQ** *sif. köhn.* Qarğış ifadə edən söz (adətən köməkçi feillərlə işlənir). [Ana qışqırır:] *Əndamın açılsın, qaraduvaq olasan, yaşın qara gəlsin, ay Gülpəri, uşağı yandırdın!* H.Sarabski.

**QARAFATMA** *is. zool.* Evlərin soba və buxarıya yaxın isti divar dəliklərində gizlənən və gecələr kəsik-kəsik cırıldayan qaramtıl cücü. *Küncə-bucağa dolmuş qarafatmaların qəmli cırıltıları çöldəki böcəklərin səsinə qarışmışdı.* İ.Şıxlı.

**QARAGEYMİŞ** *is. dan.* Bədbəxt, yazıq. [Mamaça:] *A, a, a! Qarageymiş, .. heç xəbərüvüz var ki, bizim kənddə Kəblə Qayxanım doğub?* H.Sarabski.

**QARAGİLƏ** 1. *sif.* Dənəsi, giləsi qara olan. *Qaragilə üzüm.*

2. *is.* Salxımlı qara və ya qırmızı turş meyvəsi olan kol bitki və bu bitkinin meyvəsi. *Qaragilə xırda kol bitki olub, sıra ilə düzülmüş yumurtaşəkilli yaşıl yarpaqları və tək-tək yerləşən çəhrayı çiçəkləri vardır.* Əliyev. *Bu meşələrdə milyonlarla özü özbaşına bitən alma, armud, qarğıdalı, qaragilə, alça, zoğal, hər nə desən, var.* S.Rəhimov. – *Yanır kəpənəyin zərif qanadı; Quruyur yemşanın qaragiləsi.* X.Rza.

3. *sif. dan.* Qaragöz mənasında. // Azərbaycan xalq havalarından birinin adı.

**QARAGÖZ(LÜ)** *sif.* Gözləri qara. *Qaragöz qız. Qaragöz oğlan. – Böyük qız ucaboylu, incəbelli, qaragözlü, uzun qarasaçlı, .. nəzakətli bir .. gözəl olduğunu sübut edirdi.* S.S.Axundov. *Qaragözlü, şahin oğlan; Az danışar, düşünərdi.* N.Rəfibəyli. // *is.* Qaragöz qız mənasında. *Bu qaragözlüləri bunca sevmişəm, Vahid! Nə yaxşı olmamışam bəxti qarə, şükr olsun!* Ə.Vahid.

**QARAGÖZLÜK: qaragözlük etmək** *dan.* – yalandan ağlamaq, aldatmaq üçün özünü ağlayan kimi göstərmək.

**QARAGÜL** *is.* Orta Asiyada yetişdirilən qiymətli, qıvrımtüklü dərisi olan qoyun cinsi. // Bu qoyunun dərisi; Buxara dərisi. [Mirzə Muxtarın] *həmişə damağında əyri qəlyan olardı, soyuq havada boynu qaragül dərili uzun paltonu çiyninə salardı.* İ.Şıxlı.

**QARAGÜN(LÜ)** *sif.* Bədbəxt, başıbəlalı, yazıq; həyatı, güzəranı çox ağır keçən. [Səkinə xanım:] *Sənin adına və abrına zərər yetişməsin deyən, mən gərək ömrüm olduqca özümü qaragünlü edim?* M.F.Axundzadə. // İs. mənasında. *Kim ki səninlə olmadı sübhi-əzəldə aşina; Taəbəd ol qaragünün bəxti səhab içindədir.* Nəsimi. *Hər yerdə qaragünlü xətadan uzaq olmaz.* Q.Zakir.

**QARAGÜNÇÜLÜK** *is. dan.* Əziyyət, çox çətinlik, məşəqqət, məhrumiyyət. *Hər bir müsəlman qaragünçülük ilə bir əlli-altmış manat cibində görən kimi, gecə yatıb səhər durur, övrətinə xəbər verir ki,* "*ağam məni istəyib*". C.Məmmədquluzadə.

**QARAGÜNLÜK: qaragünlüyünü qablaşdırmaq** *dan.* – hər cür məhrumiyyəti, çətinliyi, təhlükəni və s. arzuolunmaz şeyləri gözü önünə almaq, ona hazır olmaq. [Gileyгüzarov] *bu qənaətə gələndən sonra, mən binəva öz qaragünlüyümü qablaşdırdım.* S.Rüstəm.

**QARAGÜRUHÇU** *is. tar.* Çar Rusiyasında: silahlı talançı bandaların iştirakçısı; irticaçı padşahpərəst təşkilatlardan birinin üzvü. *Qaragüruhçu dəstələr. Qaragüruhçu təşkilatlar.* // Ümumiyyətlə, qatı irticaçı. *Vəziyyətdən çıxmaq üçün yeni ildə uşaqlardan təhsil haqqı alınması qərara alındı. Belə olduqda camaat arasında narazılıq yarandı. Bundan istifadə edən qaragüruhçular Sabirin üzərinə daha şiddətlə hücuma keçməyə başladılar.* "Hophopnamə".

**QARAGÜRUHÇULUQ** *is.* Qaragüruhçunun fikir və zehniyyəti, işi, əməli; qatı irticaçılıq.

**QARAĞAC** *is. bot.* Meşə zonalarında təsadüf edilən oduncağı bərk, qol-budaqlı böyük ağac. *Qarağac Azərbaycanda qədim zamanlardan bəri becərilən, sıx kölgəlik əmələ gətirən bəzəkli ağaclardan biridir.* Qədirov.

**QARAĞAT** *is. bot.* Xırda üzüm kimi salxımlı, turşməzə, qara və qırmızı meyvəsi olan kol-bitki və onun giləmeyvəsi. *Giləmeyvədən qarağat, çiyələk, moruq və başqalarında* "*C*" *vitamini vardır. – Kişmiş ilə hüccət edir qarağat.* Q.Zakir. [Laçın] *əvvəlcə Gülyazla bərabər dərəyə enib qarağat yığdığını .. xatırlayanda uşaq kimi sevindi.* M.Hüseyn.

**QARAHƏLLƏ** *is.* Xalq təbabətində işlətmə dərmanı kimi işlənən bitki və onun toxumu.

**QARAXƏBƏR** *is. dan.* Daim bəd danışan, pis xəbər verən adam.

**QARAXƏT(Lİ)** *sif.* Üzündə qara xətt (üzdən vurulmuş saqqal) olan. [Sənəm xanım:] *Arıq, lakin sağlam çöhrəli, qaraxətli, parlaq və cəsur gözlü bir oğlanın divan qabağında qürurla durduğunu görür.* Çəmənzəminli.

**QARÁJ** *is.* [*fr.*] Avtomobillərin, motosikletlərin dayanacağı və təmir edildiyi yer, bina. *Yusif onu minik maşınına, hətta qaraja aparmaq istəmişdi.* Mir Cəlal. *Göz baxdıqca hey maşındır, hey qaraj; Amma dibdə cibim dolu, qarnım ac!* Şəhriyar.

**QARAQABAQ** *sif.* Üzü gülməyən, qaşqabaqlı; üzügülməz, adamayovuşmaz. *Qaraqabaq adam. – Yazıq o şəxsə ki qaraqabaqdır;*

*Nə qədər yaraşır insana gülmək!* M.Müşfiq. *Evində və kənarda bəzən əsəbi, qaraqabaq, qaradinməz görünən bu qadının burada, bağçada kədərləndiyini, ya hirsləndiyini görən olmamışdı*. Mir Cəlal.

**QARAQABAQLIQ** *is.* Qaraqabaq adamın xasiyyəti, xüsusiyyəti; qaşqabaqlılıq, üzügülməzlik.

**QARAQALPAQ** *is.* Qaraqalpaq MR-in əsas əhalisini təşkil edən, türk dilləri qrupuna daxil olan bir xalq və bu xalqa mənsub adam.

**QARAQALPAQCA** *zərf* və *sif.* Qaraqalpaq dilində. *Qaraqalpaqca danışmaq. Qaraqalpaqca-rusca lüğət*.

**QARAQANÇIR** *is.* Bərk əzilməkdən bədənin hər hansı bir yerində qanın dəri altında qaralıb bərkiməsi. *Uşağın barmağı qapı arasında qalıb qaraqançır olubdur.*

**QARAQAPAQ** *is.* Samovarın qaynamasını azaltmaq üçün, onun odluğunun başına qoyulan və odun közərməsinə mane olan qapaq. *Samovarın qaraqapağını basmaq. – Qız, əlində samovarın qaraqapağını sürtərək, saçı, başı nizamsız özünü bayıra atır*. H.Sarabski.

**QARAQARĞA** *is.* 1. Parlaq qara tükləri olan iri qarğa.

2. *məc.* Yaşı çox olduğuna baxmayaraq, saçları ağarmayan adam haqqında. *Qaraqarğa qarımaz*. (Məsəl).

**QARAQAŞ(LI)** *sif.* Qaşları qara olan. *Qaraqaş oğlan. Qaraqaş qız. – Zeynəb qaraqaş, qaragöz bir qız idi*. S.S.Axundov. *Qızı qaraqaş, qaragöz, ..* [Məmmədin] *nəzərində gözəl bir qızdı*. C.Cabbarlı. [Ərknaz] *miniatürlərdə rəsm edilən badamgözlü, qaraqaşlı, incəbel qızlara bənzəyirdi*. M.Hüseyn.

**QARAQILÇIQ** *is.* Qılçığı qara olan buğda və ya çəltik çeşidi. *İri qaraqılçıq sünbüllər Cahandar ağanın ayağına toxunsa da, kişi vəziyyətini dəyişmədi.* İ.Şıxlı.

**QARAQINIQ** *is. bot.* Xırda çiçəkli çoxillik bir bitki.

**QARAQIŞQIRIQ** *is.* Səs-küy, çığır-bağır; heç bir ciddi səbəb olmadan qaldırılan hay-küy, qışqırıq. *Birisi qəflətən gəlib ..* [Səlimi] *tərpətdikdə, o qaraqışqırıq qoparır, qapıdan yapışıb buraxmırdı.* S.Rəhimov. [Qaraçı] *səhər qaraqışqırıq salır ki, gecə uşaq anasının altında qalıb boğulub.* H.Sarabski.

**QARAQIŞQIRIQÇI** *sif.* və *is.* Səs-küy salan, çığır-bağır edən, heç bir ciddi səbəb olmadan və qarasına qışqırıq qoparmağı adət etmiş (adam).

**QARAQIZDIRMA** *is.* Xalq arasında malyariyaya verilən ad; isitmə. *Bu qaraqızdırma məni əldən salıb, – deyə oğlan böyümüş gözlərini ağır-ağır qaldırıb, Xəlilin üzünə baxdı.* M.Hüseyn.

**QARA-QORXU** *is.* Birini qorxduğu və ya çəkindiyi bir şeylə və ya bir işlə hədələmə, qorxutma; hədə. ☐ **Qara-qorxu gəlmək** – qorxutmaq, hədələmək. *Mənə bir bunca qara-qorxu gəlmə ruzi-məhşərdən; Qiyamət varmı, ey vaiz, firaqi-yardən artıq?* M.V.Vidadi. *Tükəzban xala dincələ bilmirdi. Qarının dedikləri yadına düşdükcə vahimələnir, ürəyinə yüz cür qara-qorxu gəlirdi.* İ.Şıxlı.

**QARAQOVMA: qaraqovmaya salmaq** *dan.* – təqib etmək, qısnamaq, sıxışdırmaq, tələsdirmək.

**QARAQOVURMA** *is. aşp.* Yalnız ətdən ibarət olan qovurma növü.

**QARAQOYUNLULAR** *cəm, tar.* XV əsrdə Cənubi Azərbaycanda və onunla həmhüdud olan başqa ölkələrdə hakimiyyət sürmüş oğuz-türkmən qəbilələrindən biri. *Qaraqoyunluların mənşəyi haqqında məlumat belədir: Qara Yusif ibni-Qara Məhəmməd ibni-Bayram xacə ata-babadan türkmən Qaraqoyunlu qəbilələrindən bir çoxunun əmiri idi.* A.Bakıxanov.

**QARAQUL** *is.* Keçmiş zamanlarda qara irqə mənsub olan hər bir adama, zənciyə verilən ad; qulam. *Qrimə başladıq, mən də özümü bir qaraqul eləmişdim. Həm də: – Ərəblər qara olur, – deyə özümü bu şəklə salmışdım*. H.Sarabski.

**QARAQULAQ** *is. zool.* Tülküyə bənzər yırtıcı heyvan.

**QARA-QURA** *is.* 1. Qarabasma. [Əhməd:] *Ay oğlum, .. adamı yuxuda çox qara-qura basar, hər yuxuya inanmaq olmaz.* (Nağıl).

2. B a x **qara**[1] 6-cı mənada. [Gülnisə:] *Ürəyimə min cür qara-qura fikirlər gəlir.* Ə.Haqverdiyev. *Ürəyinə gələn qara-qura ilə dəqiqədən-dəqiqəyə narahatlığı artan Dövlət nə edəcəyini bilməyirdi.* Ə.Əbülhəsən.

**QARAQURD** *is. zool.* Qabıqlı böcək cinsindən olub, bəzi yerlərdə dozanqurdu adlanan qara bir böcək. // Orta Asiyada yaşayan qara rəngli zəhərli hörümçək növü.

**QARAQUŞ**[1] *is.* Qartal. *Şirə yığmaqda idi bal arısı zəhmət ilə; Qaraquş gördü onu, söylədi çox nifrət ilə.* A.Səhhət. [Tağı əmi] *göyün üzündə bir qara nöqtə kimi görünən alıcı quşu .. göstərərək deyirdi: – Bax, o göy üzündə quş qaraquşdur. Ova çıxıbdır.* S.S.Axundov.

**QARAQUŞ**[2] *is.* Dırnağın ətrafındakı ətdən bəzən aralanıb çıxan incə qabıq.

**QARAQUZEY** *is.* Yüksək binanın və ya hündür bir yerin arxasında olub, çox zaman günəş görməyən yer, torpaq.

**QARALAMA** 1. "Qaralamaq"dan *f.is.*

2. *is.* b a x **qara**[1] 5-ci mənada. *Ona görə* [Möhlətov] *nə plan tökdü, nə qaralama yazdı.* Mir Cəlal.

**QARALAMAQ** *f.* 1. Qara rəng çəkmək, qara sürtmək, qara rənglə çirkləndirmək, qara rəngə batırmaq. *Uşaqlar divarları kömür ilə qaralamışlar*. // Cızma-qara etmək.

2. Əl ilə yazmaq. *O, əlindəki karandaşla qabağında duran bir parça kağızı qaralayırdı. – Sərvərov tez stol yeşiyindən kağız çıxarıb əmri qaraladı, özü aparıb makinaçıya verdi*. Mir Cəlal. // Bir şeyin ilk mətnini, ilk layihəsini, planını yazmaq, qeyd etmək, eskizini çəkmək. *Məqalənin mətnini qaraladım. – Səhərdən axşamacan Dədə palıdın kölgəsində oturub kağız-kuğuz qaraladı.* İ.Məlikzadə. *Gənc rəssam şahidi olduğu mənzərəni tələsik dəftərinə qaralayırdı.* Ə.Məmmədxanlı.

3. Yazılmış yazının üstündən qələm çəkmək, pozmaq. *Siyahıda adını qaraladılar. – ..Kazım ilə söhbətdən sonra müdir onun adını qaraladı.* Mir Cəlal.

4. *məc.* Ləkələmək, qara yaxmaq, üstünə böhtan atmaq, biabır etmək. *Adamı qaralamaq yaxşı iş deyil. – Balaxanım Lələşova dedi: – Sən kiri, sən ona-buna söz atıb onu-bunu qaralama.* S.Rəhimov. *Tariximin neçə-neçə varağını; ləkələdi; qaraladı.* B.Vahabzadə.

5. İtirmək, qarışdırmaq, pozmaq; görünməz, nəzərə çarpmaz hala salmaq. *İzini qaralamaq.*

6. *dan.* Bir şeyin yerini, bünövrəsini nişanlamaq. *Burada toxumların yerini qaralamışıq. Çəpərin yerini qaralamaq. – Ən uca, ən qoca palıdın otuz-qırx addımlığında balaca bir koma qaralamışdı və Bağır bu komada olanda ən uca, ən qoca palıdın hənirini eşidirdi.* İ.Məlikzadə.

**QARALANMA** "Qaralanmaq"dan *f.is.*

**QARALANMAQ** "Qaralamaq"dan *məch.*

**QARALAŞMAQ** *f.* Uzaqdan görünmək (çoxlu qara şey haqqında). *O yanlarda dəniz buruqları qaralaşırdı*. M.Hüseyn.

**QARALATMA** "Qaralatmaq"dan *f.is.*

**QARALATMAQ** 1. B a x **qaralamaq**.

2. B a x **qaraltmaq**.

**QARALEYLƏK** *is. zool.* İsti ölkələrdə yaşayan leyləklər fəsiləsindən bədəni ağ, başı və boğazı isə qara iri, quş.

**QARALIQ** *is.* Qara şeyin halı. *Saçın qaralığı. Dərinin qaralığı.*

**QARALMA** "Qaralmaq"dan *f.is.*

**QARALMAQ** *f.* 1. Qara olmaq; hisdən, günəşdən, yaxud başqa bir şeyin təsirindən rəngi qara olmaq, rəngi tündləşmək. *Qazan ocaq üstə qalıb qaralmışdır. Lampanın şüşəsi hislənib qaralmışdır. Günün altında gəzib qaralmaq. – Kürəkləri də tərdən və hisdən qapqara qaralmışdır.* M.S.Ordubadi. [Mirzə Möhsün] *bir az kökəlmiş, bir az da qaralmışdı*. Qantəmir.

2. Qaranlıqlaşmaq, tutulmaq (hava, günəş, göy və s. haqqında). *Qışda hava tez qaralır. Qərbdə üfüq qaralır. – Bu zaman hava yavaş-yavaş qaralmağa başladı.* İ.Əfəndiyev. *Hamısı .. bizim həyatımızı isindirən bir azad günəşin qaralmaması üçün öz həyatlarını fəda verdilər.* Ə.Məmmədxanlı.

3. Sönmək, keçmək; sönmək üzrə olmaq; soyumaq. *Ocaq qaraldı. Manqalda kömür qaraldı. – Baxaraq günəşə dedim: şivəkar; Qaralsan dönməzmi cahan zülmətə?* M.Rahim. *Uzaqda fişənglər yanır, qaralır; Başımın üstündə güllə fit çalır.* Ə.Cəmil. // Qaranlıq çökmək, qaranlıq içərisində görünməz olmağa başlamaq, yaxud işıqları sönmək. *Daxmalar sakit-sakit qaralırdı.* M.Hüseyn.

4. Görünmək (qara şey, qaraltı haqqında). [Vəli:] *Bəsdir, çox vəz vermə, görürsənmi*

*yuxarıda bir zad qaralır.* M.F.Axundzadə. [Rəşid:] *Sən bir nəfər ilə gedib sağdakı qaralan təpənin başında uzanıb yanlara baxarsan.* H.Nəzərli. *Çayın boğuq səsinə səs verən meşə yavaş-yavaş çəndən təmizlənir, uca şam ağacları qaralmağa başlayır.* M.Hüseyn.

5. *məc.* Pərtlikdən, acıqdan, hirsdən üzünün rəngi çevrilmək; tutulmaq, pozulmaq. *Ağalar xan qaraldı, dodaqlarını gəmirə-gəmirə soruşdu: – Cənnət kişi qızını verirmi?* S.Rəhimov.

6. Tutulmaq, çətinləşmək. *Səsi qaralmaq. Nəfəsi qaralmaq. – Qoca bir an nəfəsini dərdi, çünki, ərəb kübarının ad, ləqəbi, nisbəsi bir-birinə bənd olunmuş elə uzun bir zəncir idi ki, sadalayıb qurtarınca nəfəsi qaralırdı.* Ə.Məmmədxanlı.

7. *məc.* Pisləşmək, xarablaşmaq, fənalaşmaq, əzablı, əziyyətli olmaq, məhrumiyyətlər və fəlakətlər başlamaq. *Ağca xanımın ağ günləri də beləcə qaralmış, puç olub getmişdi..* Mir Cəlal.

**QARALTI** *is.* 1. Uzaqdan görünən qara şey; kölgə. *Sürətlə gedərkən iri püstə ağacı altında bir qaraltı gördü.* A.Şaiq. *Həsən kişinin gözünə bir qaraltı dəydi.* M.İbrahimov. [Atlılar] *hər yeri arayıb-darayır, kiçik bir qaraltı belə buraxmırdılar.* M.Rzaquluzadə.

2. Qara yer, qaralmış yer, ləkə. *Qolunda balaca qaraltı var.*

**QARALTMA** "Qaraltmaq"dan *f.is.*

**QARALTMAQ** *f.* 1. Qara rəngə boyamaq, bulamaq; qara etmək. *Saçlarını qaraltmaq. Üst-başını qaraltmaq. Lampanın hisi şüşəni qaraltdı.*

2. Pozmaq, üstündən xətt çəkmək. *Arvad qiyamət qoparıb öz adını qaraltdı.* Mir Cəlal.

3. *məc. dan.* Üzdən, başdansovma belləmək, təpmək. *Ağarza fikirləşirdi ki, olub-keçəni yaddan çıxarsın, dağların döşünü bel, kərki ilə qaraldıb bir-iki batman arpa səpməklə güzəran keçirsin..* Mir Cəlal.

**QARAMA** *is. məh.* 1. Çay və bulaq ətrafındakı palçıqlı su, lığ. *Soyunun, dizə qədər çirmənin, bu gölməçələri gəzin, donuz qaramaya girdi.* S.Rəhimov. *Bəhram ayağını üzəngiyə qoyub minmək istərkən yəhər çevrildi, o da böyrü üstə qaramaya yıxıldı.* Ə.Vəliyev.

2. Qapaz. *Başına bir qarama saldı.*

**QARAMAQ** *f. məh.* bax **qarğımaq**.

**QARAMAL** *is.* Buynuzlu iri ev heyvanı (öküz, camış, inək). *Qaramal kənd təsərrüfatı heyvanları içərisində əsas yer tutur. – Məhəmmədhəsən əmi gördü ki, daldan genə bir dəstə qaramal gəlir.* C.Məmmədquluzadə.

**QARAMIX** *is. bot.* Xoşiyli çiçəkləri olan kol bitki. *Faytonçu müvazinətini saxlaya bilməyib səldirlədi, iki addımlıqdakı qaramıx kolunun üstünə yıxıldı, kürəyinə tikan doldu.* M.Hüseyn. *Zaman kişi .. elə fısıldayıb gücənirdi ki, sanki yerdən dartıb qaramıx kökü çıxarırdı.* Ə.Əbülhəsən.

**QARAMTIL** *sif.* Qaraya çalar. *Qaramtıl tük. – Onun* [Cahandar ağa] *qaramtıl çöhrəsi avazıdı, sonra boğulub qaraldı.* İ.Şıxlı. *Qaçay atasının tüklü üzündə, qaramtıl dodaqlarında qəribə təbəssüm sezdi.* İ.Məlikzadə.

**QARAMUM** *is.* Arıların yağlı maddələrdən hasil etdikləri qara rəngli mum.

**QARANAL** *sif.* və *zərf* Nalsız, nallanmamış. *Atı qaranal minmək. – Dedin, at qaranaldır.* S.Rəhimov.

**QARANƏFƏS** *zərf* Çox tələsik, birnəfəsə, çaparaq; tövşüyə-tövşüyə. *Yuxusuzluqdan uzun yolu qaranəfəs gəldiyindən başı bərk ağrıyırdı.* Ə.Vəliyev.

**QARANİŞAN** *is. dan.* Nişanlısı olan cavan.

**QARANQU** *is.* və *sif.* "Qaranlıq" sözünün qədimi forması. *Saçın qaranqusundan yüzün nuri göründü; Hər qanda şam olursa, ardınca sübhdəmdir.* Nəsimi. *Xurşidsiz oldu ruz ta şəb; Oldu başına qaranqu məktəb.* Füzuli. *Əgərçi yandı könlüm hicr odundan kuyuna, ey məh; Qaranqu gecələrdə şöleyi-ahım dəlil oldu.* S.Ə.Şirvani.

**QARANQUŞ** *is. zool.* Haçaquyruqlu, dar, uzun qanadlı, itiuçan köçəri quş. *Qaranquş yuvası. – Qaranquşun bədən quruluşu onun çox gözəl uçma qabiliyyətinə uyğun gəlir.* "Zoologiya". // *məc.* İlk müjdəçi, ilk əlamət mənasında. *Baharla birgə onun şux elçiləri – qaranquşlar, sığırçınlar şən nəğmələrlə dəstə-dəstə uçuşub ötüşür.* M.Rzaquluzadə.

**QARANQUŞOTU** *is. məh. bot.* Çoxillik ot bitkisi.

**QARANLIQ** 1. *is.* İşıq yoxluğu, baxanda heç bir şey görünməyən hal; zülmət. *Kəndi*

*bürümüş qaranlıq və duman əriyərək dağların ətəyinə, dərələrə çəkilir, hər tərəf işıqlanmağa başlayırdı.* M.İbrahimov. *Nərimanın gözü qaranlıqda asılan qara və uzun vedrəyə sataşdı.* Mir Cəlal. □ **Qaranlıq düşmək (çökmək, qovuşmaq)** – axşam olmaq, hava qaralmaq. *Axşam qaranlıq düşmək üzrə ikən Bakıda çilçıraq yanmağa başladı.* S.Rəhimov. *..Günəş çoxdan batmış, qaranlıq çökmüşdü.* Ə.Məmmədxanlı. **Qaranlıq etmək (eləmək)** – kölgələndirmək, görünməz hala salmaq. *Get, get, qabağımızı qaranlıq eləmə.* S.Rəhman.

2. *sif.* İşıqdan məhrum, işığı olmayan; işıqsız, zülmətli. *Qaranlıq otaq. Qaranlıq küçə. Qaranlıq gecə. – Qaranlıq yerdə daş atmazlar.* (Ata. sözü). *İçərişəhərdə qaranlıq dar bir dalanda kiçik bir otaq tutub, anamla yoxsul həyat keçirirdik.* A.Şaiq. *Xanın doqquz ay qaranlıq tövlədə bəslənmiş harın buğasını meydana çıxardılar.* M.Rzaquluzadə.

3. *sif. məc.* Bəlli olmayan, aydın olmayan, anlaşılmaz. *Qaranlıq məsələ. Onun mənası qaranlıq qaldı. – O hansı qaranlıq məsələdir?* M.S.Ordubadi. // *məc.* Şübhəli, şübhə oyandıran. *Onun çox qaranlıq keçmişi vardır.*

4. *is. məc.* Cəhalət, mədəniyyətsizlik, mədəni gerilik mənasında. *..Bizim qabağımızda dağ kimi duran istibdad, Şərq istibdadı və Şərq qaranlığı idi.* C.Məmmədquluzadə. [Fərhad:] *Mən deyirəm ki, camaat qaranlıqdadır, biz gərək gedib oxuyaq, gələk, əlimizə qələm alaq, onlara nicat yollarını göstərək.* Ə.Haqverdiyev. // *sif.* Cahil, mədəniyyətsiz, mədəniyyətcə geri mənasında. *Nərimanovun bədii əsərlərində keçmişin qaranlıq mühitindən, lənətlə və nifrətlə qarşılanan mənzərələrindən söhbət gedir.* M.Arif.

◊ **Qaranlıq quyuya daş atmaq** – qəti bir şey bilməyərək, fərziyyə ilə məşğul olmaq, təxmin etmək, güman etmək.

**QARANLIQLAMAQ** 1. B a x **qaranlıqlaşmaq**. [Xudayar bəy:] *..Qərəz, keçib, indi hava qaranlıqlayır, mən dəxi kəndə qayıda bilmərəm.* C.Məmmədquluzadə.

2. Qaranlıq etmək, kölgə etmək, kölgələndirmək.

◊ **Yaman yerdə qaranlıqladıq** – çətin, çıxılmaz, qorxulu vəziyyətə düşmək mənasında. *Gülpəri atlını görcək qorxuya düşdü: – Yaman yerdə qaranlıqladıq,* – [dedi] S.S.Axundov.

**QARANLIQLANMAQ** b a x **qaranlıqlaşmaq**. *Axşam saat 10-da lampalar yanır, üfüqlər get-gedə qaranlıqlanır.* M.S.Ordubadi.

**QARANLIQLAŞDIRILMA** "Qaranlıqlaşdırılmaq"dan *f.is.*

**QARANLIQLAŞDIRILMAQ** *məch.* Qaranlıq hala salınmaq, qaranlıq edilmək, işıqsızlaşdırılmaq.

**QARANLIQLAŞDIRMA** "Qaranlıqlaşdırmaq"dan *f.is.*

**QARANLIQLAŞDIRMAQ** *f.* Bir yeri qaranlıq hala salmaq, daha da qaranlıq etmək, işıqsızlaşdırmaq.

**QARANLIQLAŞMA** "Qaranlıqlaşmaq"dan *f.is.*

**QARANLIQLAŞMAQ** *f.* Qaranlıq olmaq, qaranlıq çökmək, axşam olmaq, işıqsızlaşmaq. *Artıq hava tamamilə qaranlıqlaşmışdı.* M.İbrahimov. *Məsum kişi .. havanın tamam qaranlıqlaşdığını görüb yatağını açdı.* Mir Cəlal. *Ayna Sənəm qarıgildən qaranlıqlaşanda qayıtdı.* Ə.Məmmədxanlı.

**QARANT** *is.* [*fr.*] Zamin, zəmanət verən, zamin olan.

**QARAPAÇA** *is. zool.* Keçiyə oxşar çöl heyvanı. *Zaqatala qoruğunda sürülərlə maral, cüyür, qarapaça çöldonuzu, habelə çoxlu ayı, canavar, tülkü və başqa heyvanlar yaşayır. – Gecə bir dəstə qarapaça şəhərin sərhədlərinə yanaşdı.* Ə.Sadıq.

**QARAPAPAQ**[1] *is. məh.* Qaramala düşən bir növ yoluxucu xəstəlik.

**QARAPAPAQ**[2] *is. dan.* b a x **başıpapaqlı**. *Məgər burada bir qarapapaq yoxdur, qabağa çıxsın?*

**QARAPÜRƏN** *is. bot.* Düzənliklərdə, əsasən, nəm yerlərdə bitən bir bitki. *Qarapürən və ya sirkan .. aran rayonlarında çox geniş yayılmışdır, ən çox nəm yerlərdə bitir.* M.Qasımov.

**QARARAN** *is. bot.* Qış otlaqlarında bitən çoxillik yem bitkisi.

**QARASAÇ(LI)** *sif.* Saçının rəngi qara olan. *Qarasaç qız. Qarasaç oğlan. – Alagözlü, qarasaçlılar diyarı; Səndə Cabbarın, Seyidin, Nəvvabın, Üzeyirin, Bülbülün; neçə-neçə*

*nəğməkarın; qoç igidin nəğməsi var; nərəsi var*. R.Rza.

**QARASAQQAL** *sif.* 1. Orta yaşlı; nə çox cavan, nə çox qoca olan. *Bir dəqiqədən sonra qapı açılıb, uzunboylu, qarasaqqal, başının ortası qırxılmış bir adam qapıda peyda oldu.* Ə.Haqverdiyev. // İs. mənasında. [Qasım kişi:] *Böyük adamsan deyə ayaqlarının altında torpaq olmalıyıq biz?! Birini ora buyurursan, birin bura buyurursan, birinə ağzından çıxanı deyirsən! Nə ağsaqqal saya salırsan, nə qarasaqqal!* İ.Məlikzadə.

2. Saqqalı qara olan. *Qarasaqqal kişi.*

**QARASAQQIZ** *is.* Sənayedə, texnikada və xalq təbabətində işlənən saqqızabənzər qara rəngli ağac şirəsi; qatran, kitrə.

**QARASAYAQ** b a x **qaratəhər**.

**QARASINCA** *zərf* Ardınca, dalınca. [Bayram:] *Kim ilə gap eləyirəm? Tarverdinin qarasınca söylənirəm*. M.F.Axundzadə. *Camaat xörək istəyir, müdir də qapının ağzında dayanıb hər gələnə elan eləyir ki, aşpaz qaçıb, sonra da Umudun qarasınca dişinin dibindən çıxanı deyir.* İ.Məlikzadə. *Salatın qızardı. Ürəyində* "*Allah abrınızı töksün*", *– deyə gülüşənlərin qarasınca deyindi.* İ.Şıxlı.

**QARASINA** *zərf* 1. Necə gəldi, harası gəldi, bilərək-bilməyərək; görmədiyi, bilmədiyi halda. [Qaraca çoban] *gecənin zil qaranlığında o taya qarasına kəmənd atmağa başladı.* M.Rzaquluzadə.

2. Dalınca, arxasınca, ünvanına. *Nağdalı, yaxud Mehralı atlarını çapıb gedərkən hər dəfə babalarının qarasına başlarını bulayardılar, çünki hər dəfə babaları qarşısında duyduqları heyrət və sevinci başqa cür ifadə edə bilmirdilər.* Ə.Məmmədxanlı.

**QARASIZ** *sif.* Qarası olmayan (b a x **qara**[3]). *Qarasız aş.*

**QARASOL** *is. zool.* Çəki balıqlarının, dənizdə və şirin suda yaşayan növlərindən biri.

**QARASORAN** *is. dan.* Hər şeyi bilmək istəyən, sorğu-sualçı. [Heydər bəy:] *Qırışmal qarasoransan, rahdarsan, bizim yolumuzu kəsdiribsən?* M.F.Axundzadə. [Mədəd:] *Bircə mənə de görüm, neçə ildir ortalığa çıxmısan?* [Xanpəri:] *Nəyinə lazımdır? Qarasoran deyilsən ki!* Ə.Vəliyev.

**QARASOV** *sif.* 1. Qaraya çalar, qaratəhər (rəng). *Qarasov mahud. Qarasov paltar*.

2. *məh*. Qaratorpaq.

**QARASÖVDA** b a x **malxulya**.

**QARAŞAM** *is. bot*. Şimal ölkələrində yayılmış iynəyarpaqlı meşə ağacı.

**QARAŞIN** *sif.* Qarayağız, qarabuğdayı. *Arvadın yaşı əllini və bəlkə əlli beşi keçmişdi. – Amma özü mərtub, sifəti qaraşın, hündür və salamat bir arvad idi.* C.Məmmədquluzadə. *Qaraşın, xoşsima gənc başını əlləri içinə alıb düşündü.* A.Şaiq. *Bu anda qoca rəssam, dəniz sahilində rast gəldiyi qaraşın zabiti xatırladı*. M.Hüseyn.

**QARATEL(Lİ)** *sif.* Saçı qara, qarasaçlı. *Nə ayla, nə günəşlə etmərəm müqayisə; Ucaboy, qaratelli talış gözəllərini.* S.Rüstəm.

**QARATƏHƏR** *sif.* Bir qədər qara, qaramtıl, qaraya çalan, bir qədər tutqun.

**QARATƏPMƏCƏ** *sif. dan.* Qara-qorxu, hərbə-zorba, yalandan qorxutma.

**QARATİKAN** *is. bot.* Çəpər üçün istifadə edilən tikanlı kol bitki. [Quşların] *..bütün pənah yeri qaratikan çəpərləri idi ki, orada azçox yem tapa bilirdilər.* S.S.Axundov. *Yüz ocağa od veribdir o qara təndir; Çəpərlərdə bitən gördüm qaratikanı.* M.Araz. *Ocaqda atəşə rast gələn zaman; Çöp də qanad tapar, qaratikan da.* X.Rza.

**QARATOYUQ** *is. zool.* Kolluqlarda və meşəliklərdə yaşayan sarıdimdikli qaramtıl rəngli oxuyan quş. *Tağı əminin göstərişi ilə mən və Məmmədağa qaratoyuq, alacəhrə, sərçə kimi quşları tutmağı öyrənmişdik*. S.S.Axundov. *Nə bəd gündü bu; it marıq vermir; quş yoxa çıxıb; Vurduğumuz bir qaratoyuq; o da düşdü kola*. R.Rza.

**QARATORPAQ** *sif.* Rəngi qara və çürüntüsü çox olan münbit torpaq. *Qaratorpaq sahələr. – Qaratorpaq əkin yerində, həmçinin bağ, bostan yerində nazik qırmızı qurd olur ki, ona suvalcan* (*soxulcan*) *deyirlər.* "Əkinçi".

**QARAÜRƏKLİ** *sif.* Paxıl, qəlbiqara, bədxah; xainürəkli.

**QARAÜRƏKLİK** *is.* Paxıllıq, səmimiyyətsizlik, xainlik, bədxahlıq, kinlilik. *Sevdim kişi yerindən dilləndi: – Qaraürəkliyə lənət, paxılın atası gordan-gora tullansın!* Ə.Vəliyev.

**QARAVAŞ** bax **qarabaş**. *Qollarından kəniz və qaravaşlar yapışmış xanım gəlib Qotursuyun yanındakı tut bağının hasarının üstündə oturdu.* Çəmənzəminli. *Bir də görərdin ki, dövlətli qadın qollarına qızıl qolbaqlarını keçirib başına al rəngli Şirvan ipək çarşabını salıb, satıl-boğçasını qaravaşa verib hamama gedərdi.* H.Sarabski.

**QARAVƏLLİ** *is.* Azərbaycan xalq aşıq yaradıcılığında mövzusu məişətdə olan əhvalatlardan alınmış məzhəkəli janr. *Ortaboylu, əsmər bənizli, daima gülərüzlü Firuzə məzəli zarafatları, incə qaravəllilər ilə manqanın həyatına hər gün yeni bir təravət gətirirdi.* İ.Əfəndiyev. // Boş söhbət, nağıl. [Kitabpaylayan:] *Oturub hər qaravəllini oxusaq, gərək adımızı dəli qoyaq.* Ə.Haqverdiyev. [Məcid:] *Heç bir belə qaravəlli olmazdı ki, mən düşdüm... Bacı! Bu ev Mirzədadaşın evi deyil?* N.Vəzirov.

**QARAVURĞUN** *is. dan.* İflic.

**QARAYAĞIZ** *sif.* Əsmər, qarabuğdayı. *Qarayağız qız. Qarayağız oğlan. – İçəridən qarayağız, ortaboylu bir gənc gülə-gülə: – Araz, sən bu yerləri çoxmu sevirsən? – deyə soruşdu.* A.Şaiq. *Bu suyuşirin, bu qarayağız; Qızın sinəsində; Duyğusu dərin; Yeni günlərin; Şirin dalğalı ahəngi yaşar.* M.Müşfiq. *Qarayağız Fatma hamıdan qabaq gəlmişdi, bir taxtanın üstündə, hey əsnəyir və danışırdı.* M.İbrahimov.

**QARAYAXA** *sif. dan.* İstədiyindən əl çəkməyən, tutduğunu buraxmayan, qır-saqqız olub adamı təngə gətirən. *Qarayaxa adam. Qarayaxa* (z.) *olmaq.*

**QARAYAXALIQ** *is. dan.* İstədiyindən əl çəkməmə, tutduğunu buraxmama, təngə gətirmə; qarayaxa adamın xasiyyəti. *Qarayaxalıq eləmək.*

**QARAYAMAN** *is. dan.* İnsan və ya heyvanda öldürücü bir yara.

**QARAYANIQ** *sif.* Qarabəniz, qarayağız. *Kəlbalı alçaqboylu, gödək qılçaları xeyli içəriyə əyilmiş, qarayanıq bir adam idi.* S.Rəhimov.

**QARAYANIZ** bax **qarayağız**. *Şahnisə xanım qızının qarayanız çöhrəsində dolaşan fərəh və nəşəni fəxr ilə seyr* [edirdi] Çəmənzəminli. [Mələk] *zahirən kobud görünən bu enlikürək, qarayanız kişinin ürəyindən nələr keçdiyini bilmək istədi.* İ.Şıxlı.

**QARAYARA** *is.* Qaramalda, atlarda, qoyunlarda olan, bəzən də insanlara keçən yoluxucu azar. [Xavər:] *Barmaqları tökülsün o müəllimin! Əllərinə qarayara çıxsın onun! – Qışqırıq xırp kəsildi və acı hönkürtüyə çevrildi.* İ.Məlikzadə.

**QARAYATAQ** *sif. dan.* Daima xəstə olub yatağından durmayan.

**QARAYATALAQ** *is. dan.* Yatalaq, tif.

**QARAYEL** *is.* Hər şeyi qurudub xarab edən şiddətli isti və quru külək. *Yağmadı yağış, bitmədi bir danə, nə borcum? Əsdi qarayel çəltiyə, bostanə, nə borcum?* M.Ə.Sabir. *Burada xoşa gəlməyən qarayeldir, doludur.* S.Rüstəm. // *məc.* Fəlakət, müsibət, afət, bəla mənasında. *De, başından çoxmu əsdi tufan, qarayel?* S.Vurğun.

**QARAYƏHƏR** *sif. məh.* Yəhər qoyulmamış, çullu.

**QARAYONCA** *is. bot.* Mədəni çoxillik yonca bitkisi.

**QARAYORĞA** *sif.* Yerişi o qədər yaxşı olmayan və yorğasını bəzən azdıran. *Qarayorğa at.*

**QARAZURNA** *is. mus.* 1. Zil səsli zurna növü. *..Azərbaycan tarixini nəzərdən keçirsəniz görərsiniz ki, vaxtı ilə qarazurna müharibə musiqi alətlərindən biri olmuşdur.* Ü.Hacıbəyov. *Qarazurnanın fəryadı altında, böyük tonqalın dövrəsində yallı dəstəsi dövrə vuranda, Babək ilə Zərnisə oğlan və qızların başında rəqsə başladılar...* Ə.Məmmədxanlı.

2. İki zurnaçının (birisi əsas melodiyanın ifaçısı, o biri isə dəm tutan) birgə çalması. *Camaatın başı toya qarışmışdı. Qarazurna zilə çəkirdi.* İ.Şıxlı.

**QARÇI** *is. köhn.* Qarı xüsusi yerlərdə saxlayıb yayda satan adam.

**QARÇİÇƏYİ** *is. bot.* Yazın əvvəlində qar əriyən kimi açılan ağ çiçək; qargülü, xəccəgülü. *Uşaqlar qarçiçəyi və novruzgülü dərməyə getdilər. – Hələ novruzgülü var, qarçiçəyin var, gələcəklər; Yel-yağışda yuyunub gün səpiləndə güləcəklər; Üzlərin tez siləcəklər.* Şəhriyar.

**QARDAŞ** *is.* 1. Bir ata-anadan, yaxud yalnız bir atadan və ya bir anadan olan oğulların bir-birinə, yaxud bacısına nisbətən hər biri. [Qaraca çoban] *..bağıryaran bir səslə qıy vurub irəli şığıdı. İki qardaşı da gəlib ona qoşuldular.* M.Rzaquluzadə. *..Bir şəhərin beş qardaşın xanlığına parçalandı...* M.Araz. □ **Qan qardaşı** – 1) doğma qardaş; 2) *məc.* səmimi dost. *Sağımda, solumda məsləkdaşlarım; Fikir qardaşlarım, qan qardaşlarım.* X.Rza. *Seyr et, qarşındakı can sirdaşındır; İnsandır, deməli, qan qardaşındır*. Şəhriyar. **Ögey qardaş** – atası, yaxud anası ayrı olan qardaş. [Səba xanım:] *Mələkənin münasibətdə olduğu üçüncü adam sizin ögey qardaşınız Sultan Toğruldur*. M.S.Ordubadi. **Süd qardaşı** – ayrı-ayrı ata-anadan olub, bir anadan süd əmmiş iki adam. [Babək:] *Elə isə bu vaxta qədər qafil olmuşam və elə bilmişəm ki, iki qardaşım var, biri kiçik qardaşım Abdulla, digəri süd qardaşım ərəb oğlu Müaviyə...* Ə.Məmmədxanlı.

2. *tənt*. Fikir, ictimai vəziyyət və s. cəhətdən danışan şəxsə yaxın olan hər bir şəxs. [Eyvaz:] *Qardaşlar, .. atmayın, qulaq asın, bizim sizinlə işimiz yoxdur!* C.Cabbarlı.

3. Kişiyə, oğlana dostcasına, yaxud təklifsizcəsinə müraciət. *Qardaş, yol ver, keçim. Qardaş, məndən əl çək!* – [Zinət xanım:] *..Qarovulçu qardaş, sən də çıx buradan..* N.Vəzirov. *Axı, a qardaş, iki saatdır burada gözləyirəm.* Qantəmir. // **"Qardaşım"** şəklində: mehribancasına müraciət – dostum, əzizim. *Qardaşım, sənə nə oldu?* – [Şərif:] *Yeri, qardaşım, apar bu kağızı ver Baloğlana.* C.Cabbarlı.

4. *məc.* Qardaş kimi yaxın, dost olan adam haqqında. *O mənimlə qardaş kimidir.* [Mürşid] *əvvəlcə mala baxdı, sonra əkinə-biçinə getdi. Niftalıynan dostlaşıb lap qardaş oldular.* İ.Şıxlı.

◊ **Qardaş malı** – atadan qalan və qardaşlar arasında tən-bərabər bölünməli mal, miras. *Qardaş malı kimi ortadan bölər.* Q.Zakir.

**QARDAŞCASINA** *zərf* və *sif.* Qardaş kimi, ən yaxın bir dost kimi, səmimi olaraq. *Qardaşcasına söhbət etmək. Qardaşcasına münasibət. Qardaşcasına əlini sıxmaq. Qardaşcasına kömək.* – [Kəblə Rəcəbəli:] *Əlbəttə, millətlər qardaşcasına dolansalar, heç müharibə də olmaz. Hər yerdə qurd qoyunla bir yerdə otlar.* Ə.Haqverdiyev.

**QARDAŞCIĞAZ** "Qardaş"dan *oxş*.

**QARDAŞCIQ** *is.* 1. Kiçik qardaş, yaşca balaca qardaş.

2. *məc.* Nəvazişlə müraciət. *..Beşikdə qoyub getdigim qardaşcığımmısan?* "Kitabi-Dədə Qorqud".

**QARDAŞQANI** *is. məh*. Xalq təbabətində işlənən bir bitki və onun çiçəyi.

**QARDAŞQIZI** *is.* 1. Qardaşın qızı.

2. Yaşlı adamın yad qıza müraciəti.

**QARDAŞLAŞMA** 1. "Qardaşlaşmaq"dan *f.is.*

2. *is.* Müharibə edən orduların əsgərlərinin imperialist müharibələri əleyhinə etiraz əlaməti olaraq bir-biri ilə yoldaşcasına əlaqəyə girişməsi. *Cəbhədəki əsgərlərin qardaşlaşması. Matrosların qardaşlaşması.*

**QARDAŞLAŞMAQ** *f.* Qardaş kimi səmimi olmaq, yaxın olmaq. *Kiçik quşlar cəh-cəh vurub qonurkən ağaclara; Hər bir nəğmə "qardaşlaşmaq" səsləridir, sanıram*. M.Müşfiq.

**QARDAŞLIQ** *is.* 1. Qardaşlar arasındakı yaxınlıq və münasibət. □ **Qardaşlıq etmək** – səmimi dost olmaq, kömək etmək. [Fərhad:] *Musa, mənimlə doqquz ildir ki, yoldaşsan, mənə qardaşlıq eləyibsən, gərək mənə sən bir fikir çəkəsən.* Ə.Haqverdiyev. [Hacı Fərəc:] *Səni dünyada biqeyd eylərəm, hərgah sən bu işdə mənə qardaşlıq etsən.* N.Vəzirov.

2. Ögey qardaş. // Qardaş kimi yaxın dost. *Qardaşlığım* [Bəhlul] *kooperativdə işləyirdi.* Mir Cəlal.

3. *məc.* Birlik, ittifaq, dostluq, səmimi əlaqə. [Kütlə:] *Yaşasın işçilərin qardaşlığı! Ura!..* C.Cabbarlı.

**QARDAŞOĞLU** *is.* 1. Qardaşın oğlu. *Qardaşoğlun harada işləyir?*

2. Yaşlı adamın özündən kiçik oğlana müraciəti. [Dəyirmançı:] *Bilirsən, qardaşoğlu, beş qızım var, Tanrı mənə oğul zürriyyəti məsləhət görməyib*. Çəmənzəminli. [İlyas:] *Hə, qardaşoğlu, mənə kömək etmək istəyirsən, ya yox?* S.Rəhimov.

**QARDERÓB** [*fr.*] 1. Paltar şkafı. [Əbdüləli bəy:] *Biz orasını ərz edirik ki, piano, qarderob kimi alət və əsbabi-qərbiyyə ilə çaxça*

*və kasa kimi aləti-şərqiyyə bir-birinə taraz gəlmir*. C.Cabbarlı.

2. İctimai binalarda üst paltarı saxlamaq üçün xüsusi yer; paltar soyunulan yer.

**QARE** *is.* [*ər.*] *köhn*. 1. Oxucu, mütaliəçi. *Niyə bəs belə bərəldirsən, a qare, gözünü? Yoxsa bu ayinədə əyri görürsən özünü?* M.Ə.Sabir. *Ey möhtərəm qarelərim, topladığım bu əşar; Həp ürəkdən çıxan bütün ixtiyarsız fəryaddır.* A.Səhhət. *Füzulinin ah və nalələri qarelərə dəxi sirayət edib, onları da özü ilə atəşi-hüzn və ələmlə yandırır*. F.Köçərli.

2. *din*. Avaz və qiraətlə Quran oxuyan adam. *Qare yorulanda uşaqlardan biri sonuncu ayəni bərkdən təkrar edər və qare üçün dincəlməyə imkan yaradardı.* H.Sarabski.

**QARƏT** *is.* [*ər.*] Bir ölkəni, xalqı, camaatı soyma, var-yoxunu zorla əlindən alma; çapqın, çapovul, talan. *Avarın qaniçən xanı Bayan, bulqarları məğlub edərək, qətl və qarətdə əlindən gələni etdi*. A.Bakıxanov. *Dəhşətli qarət davam edirdi.* M.S.Ordubadi. ☐ **Qarət etmək** – 1) zorla və ya başqa bir vasitə ilə birinin var-yoxunu əlindən almaq; talamaq, çapmaq, soymaq. *Onlar başıpozuqdurlar. Ola bilər ki, sənin kimi dinc adamları da qarət etsinlər.* M.S.Ordubadi. *Qaçaqlar tökülüb yolçuları qarət etdilər*. Mir Cəlal; 2) *məc.* şairanə təşbehlərdə. *Könlümü qarət edir öylə ki, tari-zülfün; Rumə sanki həbəşi ləşkəri-yəğma gətirir.* X.Natəvan. *Nə könül qoydu, nə can məndə, nə səbrü nə qərar; Etdi qarət məni, ol şahidi-yəğma kim idi?* S.Ə.Şirvani. *Mən aşıq qara tellər; Ağ üzdə qara tellər; Bir namərd bir namərdin; Ömrünü qarət eylər*. (Bayatı).

**QARƏTÇİ** b a x **qarətgər**. *Çar jandarmeriyası və çar polisləri Bakı şəhərini qarətçilərə, quldurlara, adamöldürənlərə tapşırmışdı.* M.S.Ordubadi.

**QARƏTÇİLİK** b a x **qarətgərlik**.

**QARƏTGƏR** *is.* [*ər.* qarət və *fars*. ...gər] Qarətlə məşğul olan adam; soyğunçu, çapovulçu, talançı, quldur. *Məktəb dediyin qeydi-dilü bəndi-zəbandır; Qarətgəri-candır*. M.Ə.Sabir.

**QARƏTGƏRLİK** *is.* Çapqınçılıq, soyğunçuluq, talançılıq, çapovçuluq, quldurluq.

**QARGÜLLƏSİ** *is.* Uşaqların qardan qayırdıqları top, yumru. *Həvəsim yox məscidə getməyə, neynim, a bacı? Qoy gedim küçədə qargülləsi oynum, a bacı*! M.Möcüz.

**QARĞA** *is.* Leş və böcəklərlə qidalanan iri, döşü boz qara quş. *Qarğanın səsi çıxanda qar gələr.* (Ata. sözü). *Qarğaya güllə atırdım, gündə gəlib toyuqların cücələrini daşıyır*. Ə.Haqverdiyev. ☐ **Qarğa-quzğun kimi tökül(üş)mək** – bir şeyi götürmək, qamarlamaq; üstünə cummaq, yığışmaq, toplaşmaq. [Kərəmov:] *Dayanın, dayanın, qarğa-quzğun kimi tökülməyin üstümə.* S.Rəhman. *Axırda hər yandan qarğa-quzğun kimi dövlətlilər tökülüb, Şeyxi yatırtdılar.* M.İbrahimov.

◊ **Qarğa beyni yedirmək** – dəli etmək, ağlını almaq, başdan çıxarmaq. *Aşkardır ki, matışka ona qarğa beyni yedirib*. N.Vəzirov. [Tubu:] *Kişi, deyəsən, sənə qarğa beyni yediriblər, ağlın oynayıb. Ağa sənin tayıntuşundur, ona qız verirsən?* Ə.Haqverdiyev. **Qarğa beyni yemək** – dəli olmaq, gicləşmək, sarsaqlamaq, başı xarab olmaq. [Dilbər xanım:] *Çaxır içmisən, yoxsa qarğa beyni yemisən, məni evdən qovursan?.. Bəxtəvər başıma, altmış yaşında sahibim təzədən eşqə düşüb!..* N.Vəzirov.

**QARĞAAYAĞI** *is. bot.* Aran yerlərdə yayılmış yeyilən bir bitki.

**QARĞABURNU** *is.* 1. Qapını içəridən kilidləmək üçün qarmaq, ucuəyri dəmir.

2. *tex*. Dəmir və s.-ni əymək üçün xüsusi quruluşlu kəlbətin.

**QARĞABURUN** *sif. dan.* Burnunun ucu qabağa uzanmış, biçimsiz burnu olan. [Hacı] *sizin bildiyiniz qarğaburun, muncuqgöz, təkəcə saqqal hacılara bənzəməz*. Qantəmir.

**QARĞADİLİ** *is. dan.* Yalnız bir neçə adam arasında anlaşılan uydurma şərti dil. // Heç kəsin anlamadığı dil. *Mən ondan söz soruşuram, o mənə qarğadili danışır.*

**QARĞADUZU** *is. köhn. dan.* Torpaq altında tapılan yarımşəffaf kristal maddə. *..Zikr olan şeylərdən savayı hər bir əkin yerində gərək qeyri daşlardan əmələ gələn şeylər olsun. Məsələn, qarğaduzu, xörəkdə işlətdiyimiz duz, kükürd, soda, dəmir pası. Bu duzlar otlara xörəkdirlər.* "Əkinçi".

**QARĞALIBAZAR** *is. dan.* Çox səs-küy olan yer; bazar. ◻ **Qarğalıbazar salmaq** – səs-küy salmaq, bazar açmaq. [Nəriman:] *Nə qarğalıbazar salmısınız?* İ.Əfəndiyev.

**QARĞAMAQ** b a x **qarğımaq**. *Yeri, gözəl, yeri, sənə qarğamam; Ölənədək işin ahü zar olsun!* Xəstə Qasım. [Əzim baba:] *Mən elə hər zaman bu qırğını törədən mazarata qarğamışam, bu da havayı gedə bilməzdi*. S.Rəhimov. *Başmaqlarını sürüyə-sürüyə onun dalınca yortan Məsmə qarı indi də Xasaya qarğayırdı*. M.Hüseyn.

**QARĞANMAQ** *f.* Qarğınmaq. *Aldılar yarı əlimdən; Qarğana-qarğana* (z.) *getdi.* Aşıq Abbas.

**QARĞAOTU** *is. bot.* Dağlıq yerlərdə bitən zəhərli bitki (ot).

**QARĞASAQQIZI** *is. məh*. Alça, qaysı və gavalı ağaclarının budaq və kötüklərindən sızan yapışqan maddə, şirə, kitrə.

**QARĞASOĞANI** *is. məh*. Çöldə və bağlarda bitən soğana bənzər yabanı bitki.

**QARĞAŞA** *is. dan*. Qalmaqal, dava, səs-küy. [Dədə Qorqud:] *Oğul, Qarçar, nə qarğaşa edərsən?* "Kitabi-Dədə Qorqud".

**QARĞAŞALIQ** *is.* Qarışıqlıq, hərc-mərclik; səs-küy, haray, çaxnaşma, araqarışma. *İclasda qarğaşalıq daha da şiddətləndi.* Mir Cəlal. ◻ **Qarğaşalıq salmaq** – qarışıqlıq salmaq, hərc-mərclik törətmək, çaxnaşma salmaq.

**QARĞATMAQ** b a x **qarğıtmaq**. [Zibeydə:] *Sənin qərəzin budur ki, gedəsən Əziz bəyə, o əhli-zələmədən törəyənə, tamam ölülərimizin ruhunu özünə qarğadasan.* M.F.Axundzadə.

**QARĞI** *is.* b a x **qamış**. [Buğac] *yeddi-səkkiz yaşlarında ikən özünə qoşa nar çubuğundan bir yay və qarğıdan oxlar qayırmışdı.* M.Rzaquluzadə.

**QARĞIDALI** *is.* Noxuda oxşar yeməli dənləri olan, uzunsov dənliyi iki-üç qat nazik və uzun yarpaqlarla örtülü bostan bitkisi. *Qarğıdalı dənli bitkilər ailəsindəndir*. *Qarğıdalının tərkibində nişasta və yağ çoxdur*. // Bu bitkinin dəni. *Allah onun* [Halay bəyin] *ürəyinə insaf salar, heç olmasa, bir-iki xamralı çörəyi verər. Lap qarğıdalı olsun, arpa çörəyi olsun, gətirim, uşaqlar göyşüyüb səslərini kəssinlər.* İ.Şıxlı.

**QARĞIDALIÇI** *is. k.t.* Qarğıdalı becərməklə məşğul olan (adam).

**QARĞIDALIÇILIQ** *is. k.t.* Qarğıdalı yetişdirməklə, becərməklə məşğul olma.

**QARĞIDALILIQ** *is.* Qarğıdalı əkilmiş tarla, yer; qarğıdalı əkini. *Burada yamyaşıl çəltik zəmilərinə, canlı və hündür qarğıdalılığa, iri yarpaqlı tütün kollarına baxdıqca baxmaq istəyirsən*. M.İbrahimov.

**QARĞILAMA** "Qarğılamaq"dan *f.is.*

**QARĞILAMAQ** *f.* Bir şeyin üstünü qarğı ilə örtmək.

**QARĞILANMA** "Qarğılanmaq"dan *f.is.*

**QARĞILANMAQ** *məch.* Üstü qarğı ilə örtülmək (damın və s.-nin).

**QARĞILATMA** "Qarğılatmaq"dan *f.is.*

**QARĞILATMAQ** *icb.* Üstünü qarğı ilə örtdürmək.

**QARĞILIQ** *is.* Çoxlu qarğı bitən yer; qamışlıq.

**QARĞIMA** "Qarğımaq"dan *f.is.*

**QARĞIMAQ** *f.* Qarğış etmək, nifrin etmək. *Züleyxa da hər gün ağlayır. Fərhadı qarğıyırdı, ki, nə üçün onları bu qədər bəlaya saldı.* C.Cabbarlı. [Günəş] *Arazı uzaqlara, Sibir çöllərinə sürgün edərlərsə, onsuz necə yaşaram? – deyə ağlayır, üzülür, Aslan bəyə qarğıyırdı.* A.Şaiq.

**QARĞIŞ** *is*. Birisinin haqqında pis arzu, nifrin, bəddua. *Gər mənə nifrin edər düşmən, mən ondan qəm yeməm; Kim münafiqdən gələn qarğış dua nisbətlidir*. Xətayi. *Matməəttəl qalmışam ki, bu nə bəladı, nəzərdi, gözdü, afatdı, vurğudu, qarğışdı, nədi, bilmirəm.* Mir Cəlal. ◻ **Qarğış etmək** (**eləmək, tökmək** və s.) – b a x **qarğımaq**. [Şamxal] "*Ağlıma gələn dağlara, daşlara, mən nə fikirləşirəm? Allah, mənə ölüm ver, gör necə sarsaq xəyallara düşürəm*", *– deyə özünə qarğış etdi.* İ.Şıxlı. **Qarğış tutmaq** – qarğışın təsiri keçmək. *Mənim qarğışım onu tutmasa, mən heç nə bilmirəm.* M.Hüseyn.

**QARĞIŞLAMA** "Qarğışlamaq"dan *f.is.*

**QARĞIŞLAMAQ** *f.* Qarğış etmək, qarğımaq. *Kərimin anası oğlunu bu halda görcək, əhvalatdan xəbərdar olardı ki, Kərimi falaqqaya salmışlar və mollanı qarğışlamağa başlardı*. H.Sarabski.

**QARĞITMAQ** *icb.* Qarğımağa, qarğış etməyə məcbur etmək; qarğımasına səbəb olmaq.

**QARI** *is.* 1. Qoca qadın, qoca arvad. *Budur! Dünya görmüş o qarıya bax; Mənalı gözləri intizardadır*. S.Vurğun. *Ayna qarının qolundan tutaraq yanına çəkdi*. Ə.Məmmədxanlı.

2. Arvad, zövcə. *Qoca öz qarısı ilə kənddə yaşayırdı. – Əmiraslan baba uşaq kimi qızara-qızara qayıdıb öz qarısının yanında oturdu.* S.Rəhimov.

3. *məc.* Qatı, qəddar, kinli, hiyləgər (bu mənada adətən “düşmən” sözü ilə bərabər işlənir). *Qarı düşmən dost olmaz.* (Ata. sözü). *Yaxın gəlmə, qarı düşmən! Döyüşlərdə boy atdım mən*. S.Vurğun. *Qarı düşmən qəzəb və qorxusundan titrəyir.* M.İbrahimov.

◊ **Küpəgirən qarı** – araqarışdıran, fitnə-fəsad törədən, hiyləgər arvad. *Bədircahanın ağzında otuz iki dişdən birisi də qalmamışdı, gözləri ağrıyırdı və həmişə su axırdı. Mümkün deyil ki, Bədircahana küpəgirən qarı, ya ki, cəhənnəmdən biletsiz qaçan deməyəsən.* N.Vəzirov.

**QARIÇQAY** *is. zool. köhn.* Sərçədən azca böyük boz rəngli tarla quşu; torağay. *Xuyu məlaikə, özü pərinaz; Cilvəsi qarıçqay, cıqqası şahbaz.* M.P.Vaqif.

**QARIXDIRILMA** “Qarıxdırılmaq”dan *f.is.*

**QARIXDIRILMAQ** *məch.* Çaşdırılmaq, özünü itirəcək bir hala salınmaq.

**QARIXDIRMA** “Qarıxdırmaq”dan *f.is.*

**QARIXDIRMAQ** *f.* Çaşdırmaq, özünü itirəcək bir hala salmaq. *Həsən bəy deyir: – Camaat, nə xəbərdir? Xam uşaqdır, teatr görməyib, o yazıq hürkür, siz də onu lap qarıxdırırsınız.* H.Sarabski.

**QARIXMA** “Qarıxmaq”dan *f.is.*

**QARIXMAQ** *f.* Çaşmaq, özünü itirmək. [Ağa Mərdan:] *Yoxsa, əlbəttə, mürafiə məclisində qarıxarsan, dilin tutular..* M.F.Axundzadə. *Ştirner bu haqlı təəssüfün qarşısında qarıxıb nə deyəcəyini bilmədi*. Ə.Əbülhəsən.

**QARILAŞMA** “Qarılaşmaq”dan *f.is.*

**QARILAŞMAQ** *f.* Qocalmaq, qoca halına düşmək (qadın haqqında).

**QARILAŞMIŞ** *f.sif. Qocalmış. Onun qarılaşmış bir nənəsi var.*

**QARILDAMA** “Qarıldamaq”dan *f.is.*

**QARILDAMAQ** *f.* Qarğa kimi səs çıxarmaq, qar-qar etmək. *Qarğa qarıldayıb başına qar gətirər, çaqqal ulayıb başına qal gətirər*. (Ata. sözü). *Ağaclarda qarğalar səs salıb qarıldayır*. M.Seyidzadə.

**QARILDAŞMA** “Qarıldaşmaq”dan *f.is.*

**QARILDAŞMAQ** *f.* Hamısı birdən qarıldamaq, hərə öz yerindən qar-qar etmək, səs salmaq. *Qarğalar qarıldaşıb yem axtarırlar.*

**QARILDATMA** “Qarıldatmaq”dan *f.is.*

**QARILDATMAQ** *icb.* Qarıltı səsi çıxartdırmaq.

**QARILIQ** *is.* 1. Qocalıq (qadın haqqında).

2. Arvadlıq, zövcəlik.

**QARILTI** *is.* Qarğanın çıxardığı səs, qarıldaması. [Qarğa] *ağacda adam görüb .. elə qarıltı saldı ki, bir-iki dəqiqənin ərzində meşənin qarğalarını yuvasının başına cəm etdi.* S.S.Axundov. *Ağacların başına toplaşan qarğaların qarıltısından başqa kəndin sükutunu heç nə pozmurdu.* İ.Şıxlı.

**QARIM** *is. məh.* 1. Alaçığın içinə su girməmək üçün, ətrafında qazılan çuxur, arx. *Qarım olmasaydı, sel alaçığı basardı.*

2. Müxtəlif məqsədlər üçün qazılan çuxur.

**QARIMA** “Qarımaq”dan *f.is.*

**QARIMAQ** *f.* 1. Qocalmaq, qoca yaşlarına çatmaq (bəzən “qocalıb-qarımaq” şəklində işlənir). *..Bu qırx ildə də qarıdıqca onun* [Ziba xanımın] *qısqanclığı artıbdır*. S.Rəhimov. *Səni sevən cavan olur günbəgün; Qarımaz, qocalmaz, tərtəzə gedər*. M.P.Vaqif. *Ey dünya, varmıdır səndə yarıyan; Ömür sürüb, çox qocalıb-qarıyan?* Aşıq Cümə. // *məc.* Qocalıb təcrübə qazanmaq.

2. Suda çox qalmaqdan qırış-qırış olmaq (dəri haqqında).

3. *məh.* Ciftləşmək (heyvan haqqında).

◊ **Qoşa qarıyasan (qarıyasınız)!** – ərlə arvada, yaxud yenicə evlənənlərə “birlikdə çox yaşayasınız!” mənasında xoş arzu bildirir. [Zalxa:] *Tarverdi, Pərzad ilə qoşa qarıyasan! Çoxlu oğul, qız görəsən!* M.F.Axundzadə. *Oğul fikri, qız arzusu, qoşa qarımaq; Xəyalından çıxmayırdı o xoşbaxtların*. S.Vurğun.

**QARIMIŞ** *f.sif.* 1. Qocalmış. *Qarımış arvad.*

2. *məc.* Qocalıb təcrübə qazanmış. *Saçı-saqqalı ağarmış, müharibələrdə qarımış generallar bunu artıq hiss etmişlər.* M.Hüseyn.

**QARIN** *is.* 1. İnsan və heyvan bədəninin qara ciyər, mədə, bağırsaqlar, dalaq və s. orqanlar yerləşən hissəsi. *Qarnı ağrımaq. Qarın boşluğu. Qarnı şişmək. – Eşikağası əllərini yerə dəstək verib qalxdı, arxalığını, çuxasını düzəltdi, yana sürüşmüş xəncərini şişman qarnının üstünə çəkib çıxdı*. Çəmənzəminli. // *dan*. Mədə mənasında. *Qarnı pozulmaq. – Qarın başa beladır*. (Ata. sözü). □ **Bir qarın çörəyə möhtac olmaq** – çox böyük ehtiyac içində olmaq, səfalət, yoxsulluq içində yaşamaq. [Firidun] *bir qarın çörəyə möhtac olan kəndlilərin ağır və dözülməz həyatını təsvir edərdi, hakimlərin ürəyini yumşaldar, mərhəmətə gətirərdi...* M.İbrahimov. **Bir qarnı ac, bir qarnı tox** – yarı tox, yarı ac, birtəhər. **Qarnı doymamaq** – ac qalmaq, aclıq çəkmək, doyunca yeməmək. [Kərəməli:] *..Çıxıb özgəyə nökər duracağam, hacı çox az muzd verir, bir də qarnım doymur*. M.F.Axundzadə. **Qarnını bərkitmək** – doyunca yemək, yeyib doymaq. **Qarnını doyuzdurmaq** – aclığını rəf etmək. *Hüsnübəyim həm də səxavətli imiş, kasıb-kusuba əl tutarmış, acların qarnını doyuzdurarmış.* İ.Məlikzadə.

2. Ana bətni, uşaqlıq. *Uşaq əksəriyyətlə ana qarnında doqquz ay qalır*.

3. *məc.* İç, batin. *Onun qarnındakını heç kim bilmir.*

4. *məc.* Bir şeyin qarın kimi qabağa çıxmış hissəsi. *Samovarın qarnı*.

◊ **Qarın (qarnını) otarmaq** – onun-bunun qapısında yeyib qarnını doyurmaq, özgəsinin süfrəsini güdmək. *Öz evində yeməyib, and içirəm, bir gecə aş; Qarnın otarmaq üçün nəfsini heyvan elədi.* S.Ə.Şirvani. **Qarın sallamaq** – 1) kökəlmək, şişmanlaşmaq. *Yedi, yağlandı, qarın saldı qoyuntək hamı..* S.Ə.Şirvani; 2) b a x **qarın vermək**. **Qarın vermək (sallamaq)** – əyilmək, ortası aşağıya tərəf meyil etmək; uçulmaq, qopub tökülmək üzrə olmaq. *Evin divarı qarın veribdir. – Qazmaçılar əyilib quyuya baxdıqdan sonra: – Bu quyu qarın sallayıb, indicə uçacağam, deyir.* A.Şaiq. **Qarnı ağrımaq** *məc.* – umacağı olmaq, bir şey təmənnasında olmaq, ürəyindən bir şey keçmək. *Doğrudan da, kişinin qarnı ağrıyırmış*. "Kirpi". **Qarnı burnunda** – boylu, ikicanlı, hamilə; doqquz aylıq hamilə. **Qarnı qurdlu** – qeyri-səmimi, qəlbiqara, ürəyindəkini gizləyən. **Qarnını tüstü ilə doldurmaq** – güllə ilə vurmaq (vurub öldürmək). [Heydər bəy:] *Demirəm çıxın yoldan, doldurummu qarnını tüstü ilə?* M.F.Axundzadə.

**QARINAFƏTİR** *zərf dan.* Bir qarın çörəyə, gündəlik yeməyə. *Qarınafətir işləmək.* – [Sonqulunu] *birinci ağası yağlı dillərlə üç il qarınafətir işlədib pul verməmişdi.* H.Sarabski.

**QARINAĞRISI** *is. dan.* 1. Bəhanə, üzr, yalandan şıltaq, umacaq. *Onun qarınağrısı var, qoy sözünü desin.*

2. Əziyyət, əzab. [Kosaoğlu:] *A bala, camaatın halalca haqqını niyə qarınağrısı ilə verirsən?* İ.Şıxlı. □ **Qarınağrısı olmaq** – təngə gətirmək, əziyyət vermək.

◊ **Qarınağrısına salmaq** – qorxutmaq, hədələmək (söz və işlə). *Uşaqlar, mən bu gecə Səlim bəyin mənzilinə gedəcəyəm, gərək onu qarınağrısına salam*. "Qaçaq Nəbi".

**QARINALTI** *is.* Yəhəri və ya qaltağı bərkitmək üçün atın (eşşəyin, qatırın) qarnı altından çəkilib bağlanan qayış. *Atın qarınaltısını çəkmək.*

**QARINAYAQLI** *sif. zool.* Qarınayaqlılar sinfinə mənsub olan. *Yerdə sürünməklə əlaqədar olaraq, tənək ilbizinin qarın tərəfi pəncə şəklində genişlənmiş əzələli ayaqdan ibarətdir; buna görə də belə ilbizlərə qarınayaqlı ilbizlər deyilir.* "Zoologiya".

**QARINAYAQLILAR** *cəm, zool.* Molyuskların (onurğasız yumşaqbədənli heyvanların) bir sinfi. *Yumşaqbədənlilərin bəziləri yastı formada olub, arxalarında qabıq əvəzinə qalxancıq vardır. Bunlar özlərinin geniş alt hissələri ilə sualtı daşlara möhkəmcə yapışır.. Bunlara qarınayaqlılar deyilir.* "Sualtı aləm".

**QARINBAĞI** *is.* Paltar altından qarın üzərinə bağlanan bağ.

**QARINCA** b a x **qarışqa**. *Qarıncaların yuvasında iki cür qarınca olur: qanadlı və qanadsız*. H.Zərdabi. *Kəpənəklər uçuşur; Qarıncalar qaçışır; Azuqəsin toplayır*. H.K.Sanılı. □ **Qarınca (yuvası) kimi qaynaşmaq (qaynamaq)** – b a x **qarışqa kimi qaynamaq** ("**qarışqa**"da). *Qarınca kimi qaynaşmaqda olan minlərcə adamları bir-bir gözdən keçirdi.* A.Şaiq. [Nadir] *yenə bu ailəyə* [fəhlə-

lərə] *qoşuldu, onunla bitişdi və onun ayrılmaz bir hissəsi olaraq, qarınca yuvası kimi qaynayan mədənlərin arasında itib-batdı.* B.Talıblı.

**QARINCIQ** *is.* 1. Kiçik qarın.

2. *zool.* Cücülərin bədəninin, ayaqlardan geridə olan hissəsi.

**QARINDAŞ** "Qardaş" sözünün qədimi forması. *Həman doxsan altıncı ildə qarındaşı Süleyman ibni-Əbdülməlik xilafətə əyləşdi.* "Dərbəndnamə". *Ac qarındaşlara infaq edilirmi, əmican?* M.Ə.Sabir. *Sən kimi qardaş öz qarındaşını; Atmayıb, özgə kimsə tutmayacaq.* Şəhriyar.

**QARINƏNƏ** *is.* 1. Qoca nənə; ata, ya ananın anası. *Birdən xoruzlar hinlərdə banladı, Qarınənə sübh olduğun anladı.* A.Səhhət.

2. Ümumiyyətlə, qoca arvad, qoca qarı. *Deyirlər tapılıb Babək qılıncı; Muştuluq paylayın, qarı nənələr!* M.Araz.

◊ **Qarınənə qurşağı (örkəni, cecimi)** – göy qurşağı, qövsi-qüzeh (Günəş şüalarının yağış damcılarında sınması nəticəsində göydə görünən qövs şəklində əlvan qurşaq).

**QARIN-QARINA** *zərf* Döş-döşə, lap yanaşı.

**QARINQULU** *sif.* və *is.* Qarnına qul olan, qarnına həddindən artıq qulluq edən, çoxyeyən; doymaz, yeyimcil. *Qarınqulu adam. – Qarınqulu yeməkdə qoçaq olar, köməkdə naçaq.* (Ata. sözü). *Var idi bir qarınqulu abid.* S.Ə.Şirvani. *Bu oğlanın yaman qarınqulu olduğunu bütün yoldaşları bilirdi.* Ə.Əbülhəsən.

**QARINQULULUQ** *is.* Qarınqulu, yeyimcil, doymaz adamın hal və sifəti, daima yemək ardınca düşmə; yeyimcillik. [Koxa:] *Düzü bu yaşa çatmışam, – dedi, – heç qarınquluIuq eləməmişəm.* S.Rəhimov.

**QARINLI** *sif.* 1. Qarnı böyük, yekəqarın, şişman. Q*arınlı adam. Qarınlı at. – Ağayar ucaboylu, sifətcə çox yapışıqlı, yaşı təzəcə qırxı ötmüş qarınlı bir kişi idi.* Ə.Əbülhəsən.

2. *dan.* Çoxyeyən, qarın düşkünü. *Qarınlı uşaq. O, yaman qarınlı adamdır.*

3. *məc.* Alçaq və enli; böyürləri qabarıq, şişman şey haqqında. *Qarınlı şüşə. Qarınlı samovar.*

**QARIŞ** *is.* Açıq əlin baş barmağı ucundan çeçələ barmağın ucuna qədər olan məsafə (ölçü kimi işlənir). ☐ **Bir qarış** – çox kiçik. *Bir qarış boyu var. – Haram oldu bizə bir qarış torpaq.* Q.Zakir. [Bir sümük:] *Mən daşlar altında bir tarix daşam; Min dəfə daşlara dəyən bir başam; Yataram bir qarış torpaq xanada.* M.Araz.

**QARIŞ-BULAŞ** *is. dan.* Qarışıq, səliqəsiz, tərtibsiz, nizamsız. [Məmmədəli:] *Bu ev çox qarış-bulaşdır.* N.Vəzirov.

**QARIŞDIRAN** b a x **qarışdırıcı** 2-ci mənada. *Onların arasını qarışdıran var.*

**QARIŞDIRICI** *is.* və *sif.* 1. Bir şeyi qarışdırmağa məxsus alət, cihaz. *Gilli məhlulu hazırlamaq üçün gil qatından, ya da hidravlik qarışdırıcıdan istifadə edilir.* Quliyev.

2. *məc.* Araqarışdıran, araya fitnə salan, fəsadçı.

**QARIŞDIRICILIQ** *is.* Fitnə-fəsad törətmə, ara pozma; fitnəçilik, fəsadçılıq.

**QARIŞDIRILMA** "Qarışdırılmaq"dan *f.is.*

**QARIŞDIRILMAQ** "Qarışdırmaq"dan *məch.*

**QARIŞDIRMA** "Qarışdırmaq"dan *f.is.*

**QARIŞDIRMAQ** *f.* 1. Bir şeyi başqa şeyə qatıb, bir-birindən ayrılmayacaq, yaxud çətin ayrılacaq hala salmaq. *Una qənd qarışdırmaq. Çaxırı su ilə qarışdırmaq. Qumu əhənglə qarışdırmaq.* // İki və ya çox şeyi bir-birinə qatıb birləşdirmək. ..*Karvan oğlanları ocaq qalayır, yol torbalarındakı duz qarışdırılmış arpa unundan xəmir yoğurub dəyirmi kündələri ocaqların qızmar külünə basdırır, ala çiy bişmiş bu kündələri ağızlarını pörşələyərək isti-isti yeyir, .. orda-burda taya vurduqları yüklərin yanında yerə sərilib yatırdılar.* Ə.Məmmədxanlı.

2. Bir şeyi çömçə, qaşıq və s. ilə dairəvi şəkildə çevirmək, bulamaq, qurdalamaq. *Dovğanı qarışdırmaq. Südü qarışdır, daşmasın. Stəkanı qarışdırmaq* (stəkandakı çayı qarışdıraraq içindəki şəkəri əritmək).

3. *məc.* Fitnə-fəsad salmaq, təfriqə salmaq, qarışıqlıq salmaq. [Hacı Səməd ağa:] ..*O kitab yazanın heç biri nə bəydir, nə rəiyyət. Avara-avara adamlardır. Ancaq aralıq qarışdırırlar.* Ə.Haqverdiyev. // *məc.* Pozmaq, xarab etmək. *Əgər xəbər alsan molla Səfini; Oğru dürüst qarışdırıb kefini.* Q.Zakir.

4. Qayda və səliqəni pozmaq, nizamsız bir hala salmaq, qarmaqarışıq etmək. *Stolun üstündəki kağızları kim qarışdırıb? Uşaqlar bütün şeyləri qarışdırıblar.*

5. Dolaşıq salmaq, qarışıq salmaq, səhvən bir-birinə oxşatmaq. *İki qardaş bir-birinə o qədər oxşayır ki, adam qarışdırır. İki məfhumu bir-birinə qarışdırmaq.*

6. Bir işin iştirakçısı etməyə çalışmaq. *Xahiş edirəm, bu cəncəl işə məni qarışdırmayasınız.*

**QARIŞIQ** *sif.* 1. Müxtəlif şeylərdən və ya növlərdən ibarət olan, başqa şey və ya şeylər qatılmış olan; yekcins olmayan, saf və xalis olmayan, müxtəlif ünsürlərdən ibarət olan. *Qarışıq yun. Qarışıq yağ.* // *Qoşma mənasında*. Başqa bir şeylə qarışmış. [Rzaqulu xanın] *..çöhrəsi qayət solğun isə də, yanaqlarında sarıntı ilə qarışıq bir qırmızılıq qalmışdı.* M.S.Ordubadi. *Bu anda daha da bərk uğuldayan quyudan palçıqla qarışıq daşlar fəvvarə vurdu.* M.Hüseyn. *Xan sevinc və dəhşət qarışıq qeyri-insani bir səslə hayqırdı.* M.Rzaquluzadə.

2. *İs. mənasında*. İki cinsdən olan, iki soydan əmələ gəlmiş, mələz. *Bu itin canavarla qarışığı vardır.*

3. *İs. mənasında.* Bir şeyə qarışdırılmış şey, bir şeyin içində olan başqa şey; qatışıq. *Bu buğdanın qarışığı var. Yun və ipək qarışığından toxunmuş parça.*

4. *zərf* Bir yerdə, birlikdə, birgə, bərabər. *Qaçaraqda əlini atıb, Telli xanımı pərdə qarışıq götürüb, atın tərkinə qoydu*. "Koroğlu".

5. Bir-birinə keçmiş, qarmaqarışıq, tərtibsiz, nizamsız. *Qarışıq saç. Bu kitablar çox qarışıqdır*.

6. Anlaşılmaz, dolaşıq, aydın olmayan, qeyri-müəyyən. *Qarışıq yazı. Qarışıq fikir. Qarışıq yuxu.* – [Telli] *nəhayət, qarışıq səslər gəldiyini fərq etdi*. S.Hüseyn. *Qarışıq addım səsləri yenicə uyqudan ayılıb yatağından qalxmamış Məhərrəmi diksindirdi*. H.Nəzərli.

**QARIŞIQ-DOLAŞIQ** *sif.* Çox qarışıq, çox dolaşıq, anlaşılmaz. *Qarışıq-dolaşıq yazıların içində kitabın adını tapa bilmədim.* C.Məmmədquluzadə.

**QARIŞIQLI** *sif.* Qarışıq olan, başqa şeylə qarışdırılmış, saf və xalis olmayan.

**QARIŞIQLIQ** *is.* 1. Qarışıq şeyin halı.

2. Tərtibsizlik, nizamsızlıq, qaydasızlıq.

3. Hərc-mərclik, nizamsızlıq; asayişin, əmin-amanlığın olmaması. *Qarışıqlıq düşmək. – Nə bilim, deyirlər ki, Zəncan tərəfində qarışıqlıqdır.* M.İbrahimov. *Müəllim bu qızı tanıyırdı.. Atası qarışıqlıq illərində yatalaqdan ölmüşdü.* Mir Cəlal.

4. Anlaşılmazlıq, dolaşıqlıq. *Üslubun qarışıqlığı. Fikrin qarışıqlığı.*

**QARIŞIQSIZ** *sif.* Başqa şey(lə) qarışdırılmamış, heç bir qarışığı, xəlitəsi olmayan; saf, xalis. *Qarışıqsız yağ. Qarışıqsız un.*

**QARIŞQA** *is.* Torpaq altında böyük cəmiyyət halında yaşayan zərqanadlılar fəsiləsindən kiçik cücü. *Qara qarışqa. Sarı qarışqa. Atlı qarışqa* (qarışqanın yüyürək bir qismi). *Qanadlı qarışqa.*

◊ **Qarışqa kimi,** yaxud **qarışqa yuvası kimi (qaynamaq)** – sayca həddindən artıq şey haqqında. *Küçələrdə adam qarışqa kimi qaynayır. – Şəhər yuxarısındakı bu geniş düz qarışqa yuvası kimi qaynayırdı*. Çəmənzəminli.

**QARIŞ-QARIŞ** *zərf* 1. Qarışla ölçərək. *Qarış-qarış ölçmək. Yeri qarış-qarış bölmək.* // Hər dəfəsində bir qarış. *Yaşıl otlar gecələr qarış-qarış qalxır*. Ə.Vəliyev.

2. *məc.* Qarışla ölçər kimi, heç bir yerini buraxmadan; hər tərəfini, hər yerini, hər nöqtəsini. *O yerləri qarış-qarış gəzmişəm. O bu rayonu qarış-qarış bilir. – Gəzib bu dost elləri dolansan qarış-qarış; Hər yanda görəcəksən: yüksəliş, zəfər, yarış.* Ə.Cəmil.

**QARIŞ-QURUŞ** *zərf* və *sif.* Bir-birinə qarışmış, qarışıq-dolaşıq. *Otaqda şeylər qarış-quruş haldadır. Qarış-quruş yuxular görmək.*

**QARIŞLAMA** "Qarışlamaq"dan *f.is.*

**QARIŞLAMAQ** *f.* Qarışla ölçmək.

**QARIŞMA** "Qarışmaq"dan *f.is.*

**QARIŞMAQ** *f.* 1. Başqa şeyin, ya şeylərin içərisinə girib orada itib getmək, ayrılmayacaq, fərqlənməyəcək, seçilməyəcək hala düşmək. *Boyalar qarışdı. Kağızlar bir-birinə qarışıbdır. – Bənövşə rəngli üfüqdə almaz parçası kimi parıldayan dan ulduzu əriyir, getdikcə büllurlaşan havaya qarışırdı.* M.Rzaquluzadə.

2. Birləşərək bir kütlə halına gəlmək. *Camaat nümayişçilərə qarışdı. – Yenə adamlar bir-birinə qarışıb gəzməyə, oynamağa, söhbət etməyə başladılar.* M.İbrahimov. *Qoyun-quzu bir-birinə qarışar; Qulplu qazanlardan qatıqlar daşar.* S.Vurğun. // Qovuşmaq, birləşmək, qoşulmaq. *İki çay bir-birinə qarışdı. Uzun-uzun kölgələr küçələri çal-çarpaz doğrayıb bir-birinə qarışdırdı.* Ə.Məmmədxanlı. *Bütün dəstə hücuma keçən böyük axına qarışdı.* M.Hüseyn.

3. Qarmaqarış olmaq, nizam və tərtibi pozulmaq, bir-birinin içinə girmək, dolaşıq düşmək. *Saçları elə qarışıb ki, ayırmaq mümkün deyil. – Adamlar qarışır, hər kəs istəyir qabağa gedə və axırda basabas düşür, qilü qal başlanır.* C.Məmmədquluzadə. *Onun bığları saqqalına, saqqalı da bığlarına qarışmışdı.* Qantəmir. ☐ **Bir-birinə qarışmaq** – 1) dolaşmaq, anlaşılmaz hala gəlmək. *Başımdakı fikirlər bir-birinə qarışdı.* M.S.Ordubadi; 2) həyəcan(a) düşmək, təlaş(a) düşmək, təşviş(ə) düşmək, çaxnaşma düşmək. *Bütün əfradi-ailə bir-birinə qarışmışdı. Çünki Rzaqulunun nəfəsi çox ağır və təxirlə çıxırdı.* M.S.Ordubadi. *Bazar bir-birinə qarışmışdı.* S.Rəhman. // Səs-küy düşmək, canlanmaq, hərəkətə gəlmək. *Qarışdı, səsləndi birdən aralıq..* S.Vurğun.

4. Müdaxilə etmək, iştirak etmək, bir işin gedişinə təsir etmək (adətən “işə” sözü ilə). *Özgənin işinə qarışmaq.* – [Mirzə Səməndər:] *Neçə vaxtdır buradayam, görmüsən məni belənçik işlərə qarışam?* C.Cabbarlı. *..Sən də gəlinlərinə izin ver, çadralarını atıb, işə qarışsınlar.* Qantəmir. *Bir saatdan bəri sükut içərisində oturmuş Ulduz tutqun bir səslə söhbətə qarışdı.* Ə.Məmmədxanlı.

5. Bulanmaq. *Ürəyim qarışır.*

6. Pozulmaq. *Axşamüstü hava qarışdı.*

**QARITMAQ** *f. dan.* 1. Ərə verməyib evdə saxlamaq, qocaltmaq (qızı). [Gülçöhrə:] *Mən deyirəm ki, evdə qalıb qarıtıb qocalasan?* Ü.Hacıbəyov.

2. Meyvəni bostanda saxlayıb vaxtını keçirməklə tər və təzəliyini ötürmək.

**QAR-QAR** *təql.* Qarğanın çıxardığı səs. *Qarğa qar-qar qarıldayır.*

**QARQARA**[1] *is. xüs.* Ağır şeyləri qaldırmaq üçün yüksəkdə mil üstündə dolanan və üzərindən ip sallanan çarx. // Ümumiyyətlə, üzərinə ip, sap sarınan çarx. *Dağın cəhrəsində əyrilən hər sap; Dağa sarınmışdır, bu sirri sən tap! Sanma çöl bağrında dağ bir yaradır; Əsrlər yaşamış bir qarqaradır.* Şəhriyar.

**QARQARA**[2] *is.* Ağzı, boğazı yaxalama, dezinfeksiya etmə. // Ağzı, boğazı dezinfeksiya etmək üçün işlədilən maye dərman. *Çobanyastığı çiçəklərindən hazırlanan dəmləmələrdən qarqara dərmanı kimi istifadə edilir.* Əliyev. ☐ **Qarqara etmək** – ağzı, boğazı su və ya qarqara dərmanı ilə yaxalamaq, dezinfeksiya etmək.

**QAR-QUR** *təql.* 1. Anlaşılmaz səs, danışıq. ☐ **Qar-qur etmək (salmaq)** – səs-küy etmək (salmaq), hamı birdən bərkdən anlaşılmaz sözlər danışmaq. *Elan işçiləri həyəcana saldı,* [onlar] *zavodun həyatinə yığılıb qar-qur salmağa başladılar.* H.Nəzərli.

2. Körpə uşağın çıxardığı anlaşılmaz səslər. *Uşaq öz-özünə qar-qur edir, guya danışmaq istəyir.*

**QARQUŞU** *is. zool.* Şimal meşələrində yaşayan ağ rəngli bir quş.

**QARLAMA** “Qarlamaq”dan *f.is.*

**QARLAMAQ** *f.* Qar yağmaq. *Hava soyudu, deyəsən, qarlayacaqdır.* // Qarla örtülmək.

**QARLAŞMA** “Qarlaşmaq”dan *f.is.*

**QARLAŞMAQ** 1. *f.* Qara dönmək, qar şəklinə çevrilmək.

2. *qarş.* Əylənmək üçün bir-birinə qartopu atmaq; qar atmaq; qargülləsi oynamaq. *Biz onun dərsindən qabaq; Qaçışır, qarlaşırdıq çöldə bir dəstə uşaq.* Ə.Cəmil.

**QARLI** *sif.* 1. Qarla örtülmüş, qarla örtülü. *Qarlı dağlar. Qarlı çöllər. Qarlı damlar. – Qarlı, qartallı bir yığın dağlar; Ta uzaqlardan bəmbəyaz parlar.* H.Cavid. *Ay işığı, dolu ürək, yaşıl bağ; Qızğın günəş, sərin çeşmə, qarlı dağ.* M.Müşfiq.

2. Qarla bərabər olan, qarla yağan. *Adını dəyişib, əhdini danıb; Yenə də həmən zülm, həmən əsarət; Qarmağa taxılan ətə aldanıb; Tələni görmədi zavallı millət.* B.Vahabzadə.

**QARLI-BORANLI** *sif.* Daim qar və boran olan, havası sərt olan. *Qarlı-boranlı hava. Qarlı-boranlı çöllər.*

**QARLIQ** *is.* Çoxlu qar olan yer, qar basmış yer. *Həcər meşəli qarlıqlarla irəlilədi.* S.Rəhimov.

**QARMA** "Qarmaq[2]"dan *f.is.*

**QARMAQ[1]** *is.* 1. Şey asmaq, yaxud qaldırmaq üçün ucu yuxarıya doğru əyilmiş qalın mıx, çəngəl. *Əti qarmaqdan asmaq. Paltarı qarmaqdan asmaq.*

2. Balıq tutmaq üçün ucu şiş çəngəl; tilov. □ **Qarmaq atmaq (sallamaq)** – balıq tutmaq üçün qarmağı suya salmaq. *Bir az aralıda sakit gölün başında dayanan Əlyar qarmağı sallayır və çox gözlədikdən sonra qarmağın tərpənməsinə sevinir.* S.Rəhimov.

3. İki şeyi bir-birinə ilişdirmək, bənd etmək üçün ucu əyilmiş dəmir alət, çəngəl. *..Durdum, getdim ara qapını örtdüm və gördüm ki, hələ möhkəm qarmağı da var.* C.Məmmədquluzadə. [Usta Əsgər:] *Elə diş var kəlbətin ilə çəkərlər, eləsi var maşın ilə çəkilir, eləsi də var ki, qarmaq ilə çəkilir.* A.Səhhət.

**QARMAQ[2]** *f.* b a x **qanırmaq**. *Hətta utanmadan boylu qadının; Qollarını qarıb gəzdi polislər*. M.Rahim.

**QARMAQARIŞIQ** *sif.* və *zərf* 1. Bir-biri üstünə, necə gəldi tökülmüş, bir-birinə qarışmış; qat-qarışıq, nizamsız, qaydasız, tərtibsiz. *Qarmaqarışıq kağızlar. Qarmaqarışıq salmaq*.

2. Anlaşılmaz, qarışıq, dolaşıq. *Qarmaqarışıq yuxu. Qarma-qarışıq iş. – Nizami bu qarmaqarışıq səslər davam etdiyi zaman nə isə Fəxrəddinin qulağına pıçıldadı.* M.S.Ordubadi. [Cəvahir] *ürəyini qəflətən bürümüş qarmaqarışıq, narahat hisslərdən baş aça bilmirdi.* İ.Məlikzadə.

3. Hərc-mərc, pozğun, nizamsız. *Qarmaqarışıq vəziyyət. – Düşmən bütün cəbhə boyu qarmaqarışıq bir halda ricətə başlamışdı.* M.Hüseyn.

**QARMAQARIŞIQLIQ** *is.* 1. Nizamsızlıq, tərtibsizlik, qarışıqlıq, qaydasızlıq. *Bu evə yenicə köçmüşük, hələ qarmaqarışıqlıqdan heç şey tapmaq olmaz.*

2. Hərc-mərclik, qarğaşalıq, nizamsızlıq, pozğunluq.

**QARMAQBUYNUZ** *sif.* Buynuzları qarmaq kimi əyri olan. *Gülüşgəlin qarmaqbuynuz inəkdən yaxşıca süd sağır.* S.Rəhimov.

**QARMAQCIQ** *is.* Balaca qarmaq.

**QARMAQLAMA** "Qarmaqlamaq"dan *f.is.*

**QARMAQLAMAQ** *f.* 1. Bir şeyi qarmağa keçirmək, qarmağa vurmaq, qarmağa ilişdirmək, qarmaqdan asmaq, yaxud qarmaqla qaldırmaq. // Qarmaqla tutmaq (balığı).

2. Qarmaqları bir-birinə keçirmək, yaxud bir şeyi qarmaq kimi edib bir-birinə bənd etmək, ilişdirmək. *Məftili bir-birinə qarmaqlayıb bərkitmək.*

**QARMAQLANMA** "Qarmaqlanmaq"dan *f.is.*

**QARMAQLANMAQ** *məch.* 1. Qarmağa keçirilmək, qarmaqdan asılmaq, yaxud qarmaqla qaldırılmaq. // Qarmaqla tutulmaq (balıq).

2. Qarmaqla bir-birinə bənd edilmək, keçirilmək, ilişdirilmək, bərkidilmək.

**QARMAQLI** *sif.* Ucunda qarmağı olan. *Qarmaqlı zəncir. Qarmaqlı kəmər.*

**QARMAQŞƏKİLLİ** b a x **qarmaqvari**.

**QARMAQVARİ** *sif.* Qarmağa oxşayan, qarmaq kimi əyri. *Ənqa quşunun .. çatma qaşları vardı, amma qarmaqvari dimdiyi qartal dimdiyini andırırdı və dörd qanadı ilə caynaqlı iki əli fantastik görkəmini tamamlayırdı.* Ə.Məmmədxanlı.

**QARMALAMA** "Qarmalamaq"dan *f.is.*

**QARMALAMAQ** *f.* Tez-tələsik tutub götürmək, qapmaq, yapışmaq, tutmaq, qamarlamaq. [Axund] *gah o xuruşdan, gah bu xuruşdan qarmalayıb plova qarışdırıb udurdu içəri.* Ə.Haqverdiyev. // İkiəlli tutmaq.

**QARMALANMA** "Qarmalanmaq"dan *f.is.*

**QARMALANMAQ** *məch.* Tez-tələsik ikiəlli götürülmək, qapılmaq, qamarlanmaq.

**QARMÓN** *is.* [*rus*. əsli *yun*.] Üzərində dilləri olan iki taxtaya bənd edilmiş açılıb-yığılan körüklərdən ibarət musiqi aləti. *Sazın, kamançanın, qarmonun, tarın; Oxuyub-çalanın, gülün, baharın; Ədibin, şairin, hər sənətkarın; Ən böyük qiyməti bizim yerdədir.* Ə.Vahid. *Hamının "Mişka" deyə çağırdığı sarı telli oğlan qarmon çalardı.* İ.Şıxlı.

**QARMONÇALAN, QARMONÇU** *is.* Qarmon çalan çalğıçı. *Qarmonçalan Minayənin dalınca bəlkə bir uşaq qaçırmaq lazım idi.* Ə.Əbülhəsən. *Qarmonçu, Tahirin heç gözləmədiyi bir ustalıqla qaytağı çalanda, rus uşaqları daha da ucadan əl vurdular.* M.Hüseyn.

**QARMONÇULUQ** *is.* Qarmonçu peşəsi, sənəti.

**QARMÓŞKA** [*rus.*] b a x **qarmon**. *İvana kamança xoş gəlmir. Ona qarmoşka lazımdır.* M.S.Ordubadi.

**QARNAQ** *is. məh.* Qar duran yer, qar qalmış yer.

**QARNIAÇIQ** *sif.* və *is. dan.* Lüt, kasıb, yoxsul (bəzən təhqir yerində deyilir). [Hətəm xan:] *Bab olmayan bir qarnıaçıqla qohum olmaq mənim işim deyildir.* S.Rəhimov.

**QARNIDOLUSU** *zərf* Doyunca, doyduracaq qədər.

**QARNIŞİŞİK** b a x **qarnıyoğun**. [Əmiraslan baba:] *Bu kəndin qarnışişik Ləlaş adlı kəndxudası vardı.* S.Rəhimov.

**QARNIYARIQ** *is.* 1. Dəniz böcəyinin çox hamar və parlaq qabığı; balıqqulağı.

2. *bot.* Əksərən məzarlıqlarda bitən tikanlı, yapıq bir bitki və onun xalq təbabətində işlənən qırmızı toxumu və meyvəsi.

**QARNIYOĞUN** *sif.* və *is.* Şişman, dolğun, çox kök, yekəqarın. *Qəfəsinin dalında bir qarnıyoğun .. oturub yazıya məşğul idi.* C.Məmmədquluzadə.

**QARNİR** *is.* [*fr.*] Ət və balıq yeməklərinin yanında verilən bişmiş xəmir, tərəvəz məmulatları (makaron, kartof, göy noxud və s.).

**QARNİTÚR** [*fr.*] Bir iş üçün lazım olan şeylər komplekti. *Mebel qarnituru. Şrift qarnituru.*

**QARNİZÓN** [*fr.*] Bir yerdə (qalada, şəhərdə, istehkamda və s.-də) müvəqqəti və ya həmişəlik yerləşən qoşun hissəsi və hərbi idarələr. *Bu işdən kənddəki qarnizon xəbər tutana qədər onlar* [partizanlar] *vaxt itirməyib meşəyə qaçmışdılar.* M.Hüseyn.

**QAROV** *sif.* Qarovluğu olan. *Qarov adam.*

**QAROVLUQ** *is.* Bəzi adamların gecələr və alaqaranlıqda zəif görməsindən, ya da heç görməməsindən ibarət görmə nöqsanı.

**QAROVUL** *is.* 1. Keşikçi, gözətçi. *Qarovul əlində nizə o tərəf-bu tərəfə gedirdi.* M.S.Ordubadi. □ **Qarovul çəkmək** – keşik çəkmək, qorumaq. *Altıncısı dvornikdir, yəni gecələr həyətə qarovul çəkib, gündüzlər küçələri süpürür.* C.Məmmədquluzadə. [İskəndər:] *Bu saat sənə bir yoldaş göndərim, növbət ilə qarovul çəkərsiniz.* N.Vəzirov. **Qarovul qoymaq** – keşikçi qoymaq, gözətçi qoymaq. *Təqib etmək üçün onlarca adamı qarovul qoymuşdu.* M.S.Ordubadi. **Qarovulunda durmaq** – keşiyində durmaq, qorumaq.

2. Tüfəng lüləsinin ucunda üst tərəfdə nişan almaq üçün kiçicik çıxıntı; arpacıq. □ **Qarovula almaq** – b a x **qarovullamaq**.

3. Tilov və ya gəmi lövbərinin gözdən yayınmaması üçün, onun ipinə (zəncirinə) bağlanan və suyun üzündə qalan yüngül taxta parçası və s.

**QAROVULÇU** *is.* b a x **qarovul** 1-ci mənada. *Qarovulçu qoymaq istəyirəm, – deyə Şeyda gözlərini Arazın gözlərinə dikdi.* A.Şaiq. *Xaspolad qarovulçunun lovğa-lovğa danışdığını görərkən əsəbiləşdi.* M.Hüseyn.

**QAROVULÇULUQ** *is.* Keşikçilik, qarovulçu vəzifəsi.

**QAROVULXANA** *is.* Qarovul üçün bina, budka və s. *Bu halda qarovulxanaları yoxlamaq üçün gələn Fəxrəddin dörd nəfər yavəri ilə bərabər qarovulxanaya girdi.* M.S.Ordubadi.

**QAROVULLAMA** "Qarovullamaq"dan *f.is.* [Qoca:] *Belə tuşqul atıcı mən görməmişəm, qarovullamağı da çox uzaq çəkmədi, amma yenə düz vurdu.* A.Divanbəyoğlu.

**QAROVULLAMAQ** *f.* 1. Nişan almaq. *Tüfəng ilə quşu qarovullamaq.*

2. Pusquda dayanmaq, pusqulamaq, güdmək.

**QAROVULLUQ** *is.* Keşikçilik, gözətçilik. *Qarovulluq etmək.* // Keşik; keşik çəkmə. *Neft dəllallarına mədən qarovulluğunu Sabunçunun qoçuları çəkərdi.* H.Sarabski.

**QARÖLÇƏN** *is. xüs.* Yağmış qarın qalınlığını ölçmək üçün cihaz.

**QARPACAQ(LAR)** *is.* Kəsici qabaq dişlər, qarpan (qırpan) ön dişlər.

**QARPINMAQ** *f.* Dırnaqla bərk qaşınmaq.

**QARPIŞDIRMA** "Qarpışdırmaq"dan *f.is.*

**QARPIŞDIRMAQ** *f.* 1. Qarpışmağa təhrik etmək, qarpışmağa vadar etmək; vuruşdurmaq. *Uşaqları qarpışdırmaq.*

2. B a x **qapışdırmaq** 1-ci mənada. *Yallı bitər-bitməz, artırmadan bir-iki ovuc pul atdılar. Həyətdəkilər bir-birini əzişdirərək pulu qarpışdırdılar.* Çəmənzəminli.

3. B a x **qapışdırmaq** 2-ci mənada. *Bu əsərindən də görünür ki, bəzi əldəqayrılma alimlər kimi ordan-burdan qarpışdırmır.* M.Hüseyn.

**QARPIŞMA** "Qarpışmaq"dan *f.is.*

**QARPIŞMAQ** *f.* 1. Tutuşmaq, dalaşmaq, vuruşmaq. *Uşaqlar qarpışırlar.*

2. Bir-biri ilə küştü tutmaq, güləşmək, qurşaq yapışmaq. *Pəhləvanlar qarpışırlar.*

**QARPIZ** *is.* Qabaq fəsiləsindən iri, yumru, içi çox zaman qırmızı və çox sulu, şirin bostan meyvəsi. *Qarpız doyumluq üçün deyil, sərinlik üçündür.* (Ata. sözü). *Qarpızlar qoyun sürüsü kimi tağların üstündə yatmışdı.* İ.Şıxlı.

**QARPIZÇI** *is.* və *sif.* Qarpız satan. *Yolumuz qarpızçı dükanlarının yanından idi.* M.S.Ordubadi.

**QARPIZI** *sif.* 1. Qarpız rəngində olan. *Qarpızı çit. Qarpızı parça.*

2. Qarpız şəkilli, qarpız kimi girdə; qarınlı. *Qarpızı lampa şarı. Qarpızı samovar.*

**QARPIZLIQ** *is.* 1. Qarpız əkilən yer, qarpız bostanı. *Bostanın yarısı qarpızlıqdır.*

2. Atın qolu üstündəki əzələ.

**QARPMAQ** b a x **qapmaq** 1-ci mənada. *Cəld başının altından bumajniki qarpıb açdı..* İ.Musabəyov. *Dəsti-istibdad hər gün qarparaq arifləri; Tərd edir el, yurd içində qarparaq arifləri.* Ə.Nəzmi.

**QARSAQ** *sif.* Odla, alovla ütülmüş, üzdən yanmış. *Çörək təndirdə qarsaq-qarsaq* (z.) *oldu.*

**QARSALAMA** "Qarsalamaq"dan *f.is.*

**QARSALAMAQ** *f.* Odda ütmək, pörtmək, yaxud üzdən yandırmaq. *Təndirin alovu qolumu qarsaladı. – Sağ tərəfimdən keçən isti yel əlimi qarsalayır.* A.Şaiq. *Gün günorta yerində üzümü qarsalayır.* S.Rüstəm.

**QARSALANMA** "Qarsalanmaq"dan *f.is.*

**QARSALANMAQ** *f.* Üzdən yanmaq, ütülmək, pörtlənmək, ala-yarımçıq bişmək, üzdən qabarlanmaq. *Alma bişməyib, qarsalanıbdır.*

**QARSALATMA** "Qarsalatmaq"dan *f.is.*

**QARSALATMAQ** *f.* Qarsalanmasına imkan vermək, səbəb olmaq.

**QARSIMAQ** b a x **qarsalanmaq**.

**QARSITMA** "Qarsıtmaq"dan *f.is.*

**QARSITMAQ** *f.* Üzdən yandırmaq.

**QARSMAQ** *f. məh.* b a x **qarsalamaq**. *Yerdən qalxan alov adamın üz-gözünü qarsır, ağızda dil quruyur, dodaq cadar-cadar olub partlayırdı.* S.Rəhimov. *Alov burula-burula ətrafı qarsır.* Ə.Vəliyev.

**QARŞI** 1. *is.* Bir şeylə üzbəüz olan yer və ya şey, müqabil tərəf; qabaq. *Evin qarşısı. Dağın qarşısı. Məktəbin qarşısı. – Baxınız, qarşımı tutmuş bir axın; Güclüdən güclü, dənizdən daşqın.* M.Müşfiq. // Yerlik halında: **qarşısında** – qabağında, önündə. *Bülbülün qarşısında açıl, şirinləş; Qızılgül kimi!* M.Müşfiq. *Axund nə biləydi ki; Qarşısında dayanan; Milyonların ən böyük; Dahi müəllimidir.* B.Vahabzadə.

2. *sif.* Müqabil, üzbəüz, bir şeyin müqabilində olan. *Qarşı tərəf.* □ **Qarşı gəlmək** – üzbəüz gəlmək, rast gəlmək, qarşılaşmaq. [Azər:] *Quzu gördünmü sev, o, kin bilməz; Canavar qarşı gəlsə, parçala, əz!* H.Cavid.

3. *qoş.* Zidd, müxalif, əleyhinə, ziddinə, əksinə. *Siz istiqlaliyyət və azadlıq uğrunda aclığa və məhrumiyyətə qarşı sinənizi gərən təbrizlilərsiniz.* M.S.Ordubadi. [Surxay] *öz dostuna qarşı ittihamkar mühakimələr yürüdürdü..* İ.Əfəndiyev. □ **Qarşı çıxmaq** – əleyhinə çıxmaq, mübarizə etmək. [Eyvaz:] *..Bu gün mən ona qarşı çıxmışam, sabah sizə qarşı çıxacağam.* C.Cabbarlı. **Qarşı durmaq** – müqavimət göstərmək. *Xavər özündə onun təhdidlərinə qarşı duracaq daxili bir qüvvə hiss etdiyindən onları tez unutdu.* M.İbrahimov. **Qarşı getmək** – əksinə getmək, əleyhinə getmək, ziddinə getmək. *Haqq nə deyir? Küfrə qarşı getməyiz; Nurdan çıxıb zülmət içrə itməyiz..* Şəhriyar. **Qarşı qoymaq** – bir şeyin əleyhinə yönəltmək, bir şeyə müqabil qoymaq. *Nədən qarşı qoydu* "*mənəm*" *deyənlər; Cılız mənliyini yüz-yüz minlərə?* B.Vahabzadə.

4. *qoş.* Haqqında, barəsində. [Şirmayının] ürəyində nənəsinə qarşı zərrə qədər də şübhə oyanmırdı. M.Hüseyn. *Mirzağanın Cəmiləyə qarşı olan meyli və məhəbbəti getdikcə artırdı.* S.Hüseyn. *Azərbaycan xalqı həmişə dostlara sadiq, düşmənlərə qarşı amansız olmuşdur.* İ.Əfəndiyev.

5. *qoş.* Mübarizə etmək üçün, qabağını almaq üçün. *Milçəklərə qarşı güclü vasitə. Qripə qarşı dərman. – Sonra quraqlığa qarşı mübarizədən söhbət açdıqları vaxt Əziz içəri girib salam verdi.* Ə.Vəliyev.

6. *qoş.* Bir hadisənin yaxınlaşmasını göstərir. *Yaza qarşı.*

7. *qoş.* Üzünə, üçün. *Bəs oxu bu şeri yarə qarşı; Bülbül kimi gülüzarə qarşı.* Xətayi.

◊ **Qarşısını almaq** – bir hadisənin, işin, xəstəliyin baş verməməsi üçün vaxtında tədbir görmək, qabağını almaq. *Hadisələrin qarşısını almaq. Yanğının qarşısını almaq. Xəstəliyin qarşısını almaq. Təhlükənin qarşısını almaq. –* [Əhməd] *ilk zərbələrin qarşısını almaq, ya da camaatı sakitləşdirmək üçün bir-iki söz deməyi lazım bildi.* İ.Şıxlı. **Qarşısını kəsmək** – yolunu tutmaq, getməsinə, axmasına mane olmaq. *Selin qarşısını kəsmək. –* [Xəlil] *qərara almışdı ki, daha "həvəsdibəsdi", Bakıdan qayıdan kimi Sayadın qarşısını kəsəcək, üç il ürəyində dolanan sözləri onun üzünə deyəcək.* İ.Məlikzadə.

**qarşı-qarşıya** *zərf* Üz-üzə, bir-birinə qarşı. *Səlimi gəlib salamlaşdı və onunla* [Firidunla] *qarşı-qarşıya oturdu.* M.İbrahimov. □ **Qarşı-qarşıya gəlmək** – 1) üz-üzə gəlmək, qarşılaşmaq, təsadüf etmək, rast gəlmək, rastlaşmaq. *Nizaminin başında gedən istiqbal dəstəsi "Əli bulağı" adlı çeşmənin yanında Məhsəti xanımın karvanı ilə qarşı-qarşıya gəldi.* M.S.Ordubadi. *Qəvi bir yırtıcı ilə qarşı-qarşıya gəlmək ehtimalı canıma qor doldurdu.* Çəmənzəminli; 2) toqquşmaq, bir-birinə dəymək; 3) bir-birinə zidd olmaq, bir-biri ilə düz gəlməmək.

**QARŞIDA** *zərf* 1. Qabaqda, öndə, üzbəüz. *Qarşıda durmaq. – Qarşımda qalınca bir kitab mütaliəsi ilə məşğul olan bir qadın oturmuşdu.* S.Hüseyn.

2. İrəlidə, gələcəkdə. *Qarşıda həll edilməli çoxlu məsələlər var.*

**QARŞIDAKI** *sif.* 1. Bir şeyin lap qabağındakı, önündəki; üzbəüzdəki; qabaq tərəfində olan, irəlidəki. *Qarşıdakı bağda oturmaq. Qarşıdakı mağazadan çörək aldım. Yoldaşım qarşıdakı evdə yaşayır. – Qarşıdakı qonşunun kiçik pəncərəsindən çıxan xəfif bir işıq qaranlığın bir parçasını yırtdığından, burada uçuşan qar parçaları nəzərə çarpırdı.* S.Hüseyn.

2. İrəlidəki, gözlənilən. *Buğac isə .. cavan bir ovçu ehtirası ilə yalnız qarşıdakı ov barəsində həyəcanla düşünməkdə idi.* M.Rzaquluzadə.

**QARŞIDAN** *zərf* Qabaqdan, öndən, qabaq tərəfdən, irəlidən. *Meydana qarşıdan gəlmək. Güllən qarşıdan atdılar. Qarşıdan qabağıma bir dovşan çıxdı. – Bir gözəl keçdi qarşıdan; Gözlərindən gülə-gülə..* Aşıq Ələsgər. *Qaranlıqda qarşıdan bəzən işıq görünər; Zəncirvari vaqonlar silkələnər, gərilər.* X.Rza.

**QARŞILAMA** "Qarşılamaq"dan *f.is.*

**QARŞILAMAQ** *f.* 1. Qabağına çıxmaq, qarşısına çıxmaq, görüşünə çıxmaq. *Qonaqları qarşılamaq. – Xanım onu eyni təbəssümlə qarşıladı.* M.S.Ordubadi. *Ovdan gələnləri layiqi ilə qarşılamaq lazımdı.* M.Rzaquluzadə.

2. Gələn bir şəxsə, yaxud biri ilə görüşərkən, ona hər hansı bir vasitə ilə öz münasibətini izhar etmək. *Tamaşaçılar artisti gurultulu alqışlarla qarşıladılar. O, bizi çox soyuq qarşıladı. Qələbə ilə evlərinə dönən qəhrəmanları xalq çiçək və musiqi ilə qarşıladı. – Səba xanım Fəxrəddinin onu bir sevgi ilə qarşılayacağına heç də inanmırdı.* M.S.Ordubadi. // Bir şey haqqında xəbər tutaraq, ona qarşı müsbət, ya mənfi münasibətini ifadə etmək. *Rübabə zahirdə bu xəbəri soyuq qarşılamışdı.* Mir Cəlal. □ **Yeni ili, bayramı** (və s.-ni) **qarşılamaq** – bayram, tarixi gün və s. gəlməsi münasibəti ilə təntənəli yığıncaq, məclis, qonaqlıq və s. düzəltmək, şənlik etmək. *Parlayan saf göylərə bax, Qara dəniz; Gəl səninlə yeni ili qarşılayaq.* N.Rəfibəyli.

**QARŞILANMA** "Qarşılanmaq"dan *f.is.*

**QARŞILANMAQ** "Qarşılamaq"dan *məch.* *Qonaqlar axşam vağzalda qarşılandılar. Natiq gurultulu alqışlarla qarşılandı. – Özünü hörmətə layiq sanmadı; Böyük qəlb xidmətə əvəz istəməz; Hörmətlə, izzətlə qarşılanmadı; Ən böyük hörmətə layiq olan kəs.* B.Vahabzadə.

**QARŞILAŞDIRILMA** "Qarşılaşdırılmaq"-dan *f.is.*

**QARŞILAŞDIRILMAQ** *məch.* 1. Bir-biri ilə tutuşdurulmaq, müqayisə edilmək.

2. Üz-üzə gətirilmək, üzləşdirilmək.

**QARŞILAŞDIRMA** "Qarşılaşdırmaq"dan *f.is. Dilləri qarşılaşdırma üsulu.*

**QARŞILAŞDIRMAQ** *f.* 1. Bir-biri ilə tutuşdurmaq, müqayisə etmək. *Rəqəmləri qarşılaşdırmaq. Faktları qarşılaşdırmaq.*

2. Üz-üzə gətirmək, üzləşdirmək.

**QARŞILAŞMA** "Qarşılaşmaq"dan *f.is.*

**QARŞILAŞMAQ** *f.* 1. Qarşı-qarşıya gəlmək, üz-üzə gəlmək, rastlaşmaq. *Böyük çətinliklərlə qarşılaşmaq. – Firidun onlara* [tələbələrə] *fikir verməyib gəzmək istərkən Qurban Mərəndi ilə qarşılaşdı*. M.İbrahimov.

2. Üzləşmək.

**QARŞILIQ** *is.* 1. Bir şeyin müqabili, əvəzi, cavabı (mükafat, ya cəza). *Yaxşılığın qarşılığı. Birinin zəhmətinin qarşılığını vermək. Hər kəs öz işinin qarşılığını görər.*

2. Başqa şeyi və ya sözü tamamilə əvəz edə bilən, ona tamamilə uyğun və bərabər olan şey, söz. *Rusca sözlərin qarşılığını tapmaq. Dildə qarşılığı olmayan əcnəbi terminləri olduğu kimi götürmək lazımdır.*

**QARŞILIQLI** *sif.* 1. Bir-birinə edilən, bir-birinə göstərilən, hər iki tərəfə aid olan. *Qarşılıqlı yardım. Qarşılıqlı məhəbbət. Qarşılıqlı münasibət. Qarşılıqlı etimad.* – [Ceyniz:] *Qarşılıqlı arzu hər bir şeyin əsasıdır.* Çəmənzəminli.

2. İrəli sürülən, tələb edilən bir şeyə və ya təklifə cavab olan. *Qarşılıqlı plan. Qarşılıqlı iddia*.

3. Qarşıya gələn, üzbəüz gələn. *Qarşılıqlı qatar.*

4. Cavablı. *Qarşılıqlı məktub, teleqram*.

**QARŞISIALINMAZ** *sif.* Qabağı alına bilməyən, önüalınmaz; labüd. *Qarşısıalınmaz nəticələr. Qarşısıalınmaz hadisə.*

**QART¹** *sif.* 1. Qocalmış, qoca. *Qart qoca. Qart qarı. Qart toyuq. – Ağır yaralanmış o qart canavar; Qəzəblə sıçrayır hey üstümüzə.* S.Vurğun. *Quzu olmaz bilirik qart canavar.* M.Rahim. *Mənə ömrün boyunda isə; onda eşq olsun ala qarğaya; bir də qart qurbağaya!* R.Rza.

2. *məc.* Qatı, qəddar. [Nəbi:] *Sən lap qart qumarbaz imişsən.* S.S.Axundov. *Əvvəl-axır qıracağız qart düşmənin belini biz.* X.Rza.

3. *məh*. Kövrək, tezsınan. *Qart sümük.*

**QART²** *is. dan.* Kəsər alətləri itiləmək üçün daş; bülöv. *Dəryazları qart ilə itiləmək. Qart daşı. Mən də qart daşlara verdiyim bu hiss; Bu incə mənadan necə əl çəkim?* M.Müşfiq.

**QART³, QART-QART** *təql.* Bərk, ya kövrək bir şeyi dişlərkən, yaxud qaşınarkən hasil olan səs. *Xiyarı qart-qart dişləyib yedi. Qart-qart qaşınmaq.*

**QARTAL** *is.* 1. Dağlıq və ya çöllük yerlərdə yaşayan əyri dimdikli yırtıcı və qüvvətli iri quş; qaraquş. *Dağ qartalı. – Qartal öz gücünü duyar yuvada; Uçub cövlan edər sonra havada.* S.Vurğun. *Qartal qanad çalarkən buludsuz göy üzündə; Bir əsən yelə döndü atım Ceyran düzündə.* Ə.Cəmil.

2. *məc. tənt*. Vüqarlı, cəsur, görkəmli adam haqqında. *Hər beşik körpə aslan yuvasıdır, dəymə gəl; Qartallar yurdunun qapısını döymə gəl!* S.Rüstəm.

3. *məc.* Obrazlı təşbehlərdə: təyyarə və təyyarəçilərə işarə. *Sakit buludlarda süzəndə hilal; Döndü yuvasına bir dəstə qartal.* M.Rahim.

◊ **İkibaşlı qartal** – b a x **ikibaşlı**. *Unutmadıq ikibaşlı qartal çarı; Çəkdi bizi gah aşağı; gah yuxarı.* M.Müşfiq.

**QARTALBURUN(LU)** b a x **qırğıburun(lu)**. *Xanın bütün diqqəti yuxarı başda əyləşmiş qartalburunlu, şahbaz baxışlı, çevik hərəkətli və boy-buxunlu Ömər xanda idi.* Çəmənzəminli.

**QARTALLI** *sif.* Qartallar olan, üzərində qartallar uçan, qartal yuvaları olan. *Qartallı qayalar. – Al-yaşıl geyinmiş uca dağların; Qartallı qoynundan uzaqlaşmışam..* S.Vurğun. *Sinəsi qartallı qayalıqları; Əks edir sonalı göl səhər-səhər*. M.Araz.

**QARTI** *is.* Yapıncı; keçədən çoban bürüncəyi. *Dünya malından var: sicim çatısı; Patavası, çuxası, həm qartısı.* A.Şaiq.

**QARTIMA** "Qartımaq"dan *f.is.*

**QARTIMAQ** *f.* 1. Qocalmaq. [Sultan bəy:] *..Nə axmaq sözdür; necə yəni ərə getmək istəmirsən; evdə qalıb qocalıb qartımayacaqsan ki?..* Ü.Hacıbəyov.

2. *məc.* Təzəliyini, təravətini itirmək, köhnəlmək.

**QARTIMIŞ** *f.sif.* 1. Qocalmış.

2. *məc.* Təzəliyini, təravətini itirmiş, köhnəlmiş (insan, heyvan, bitki haqqında). *Qədir .. fikirləşdi ki, Mirzə qəribə adamdı, atasından o boyda evi yerlə-yeksan olub, yurdu dağılıb, onun dərdini çəkmir, bir qartımış ağac hayındadı...* İ.Məlikzadə.

**QART-QURT** *təql. dan.* Anlaşılmaz danışıq səsi, anlaşılmaz danışma, pis danışma (bir dildə). *Qart-qurt eləmək. – ..Ay qardaşlar, bizlərdə qardaşlıq həmiyyəti yoxdur: qart-qurt rus dili bilənlərimiz rus qəzeti gətirdirlər ki, onu əvamünnas görüb onlara artıq hörmət eləsin.* "Əkinçi".

**QARTLAMAQ[1]** *f.* Çox qartlaşmaq.

**QARTLAMAQ[2]** *f.* Bədəninin bir yerini bərk qaşımaq, dırnaqla qart-qart qaşımaq.

**QARTLANMA** "Qartlanmaq"dan *f.is.*

**QARTLANMAQ[1]** *qayıd.* Bərk qaşınmaq, dırnaqla qaşınmaq.

**QARTLANMAQ[2]** *f.* b a x **qartlaşmaq**.

**QARTLAŞMA** "Qartlaşmaq"dan *f.is.*

**QARTLAŞMAQ** *f.* 1. Qocalmaq.

2. *məc.* Gəncliyini, təravətini itirmək; sərtləşmək, qabalaşmaq.

**QARTLAŞMIŞ** *f.sif.* Qocalmış. *Qartlaşmış toyuq.*

**QARTLIQ** *is.* 1. Qocalıq.

2. *məc.* Sərtlik, qabalıq, köhnəlik.

**QARTMAQ[1]** *is.* 1. Sağalmaq üzrə olan yaranın üzündə əmələ gələn köz, qasnaq, bərk qabıq.

2. İnsan və ya heyvanın dərisi üzərindən qopub tökülən qalın kir, quru dəri parçaları; pasaq. *Camış bədəninin qartmağını ağaca sürtüb təmizləyir.*

**QARTMAQ[2]** *f.* Bərkimək, sərtləşmək.

**QARTMAQLANMA** "Qartmaqlanmaq"dan *f.is.*

**QARTMAQLANMAQ** *f.* 1. Üzü qartmaq bağlamaq, köz tutmaq, qasnaqlanmaq, qasnaq bağlamaq, qartmaqla örtülmək (yara).

2. Çirkdən qabıq bağlamaq, qartmaq bağlamaq.

**QARTMAQLI** *sif.* Qartmaq bağlamış, qartmaq örtmüş, qasnaqlı.

**QARTOP(U)** b a x **qargülləsi**. *Qartopu oynamaq. – Qar yağır lopa-lopa; Uşaqlar adamları tez-tez basır qartopa.* R.Rza.

**QARUN** *is.* [*xüs. is.*-dən] Çox dövlətli, çox varlı adam (qədim İsraildə çox dövlətli bir şəxsin adından). [Molla Salman:] *Hacı Nuru, sənin qiyasına görə, mən gərək Qarun olaydım; bəs mən niyə bir həsir və lüləyindən qeyri bir zada malik deyiləm?* M.F.Axundzadə.

**QÁRUS** [*pol.*] 1. Yumşaq yun iplik növü.

2. Yun parçaya oxşayan pambıq parça növü.

3. Qarusdan tikilmiş (toxunmuş). *Qarus parça. Qarus şərf.*

**QARZAQ** b a x **qərzək**.

**QARZAQLAMAQ** b a x **qərzəkləmək**.

**QARZAQLANMAQ** b a x **qərzəklənmək**.

**QARZAQLI** b a x **qərzəkli**.

**QASIQ** *is. anat.* Qarnın iki bud arasında olan alt tərəfi.

**QASIQBAĞI** *is.* Qasıq yırtığını (qrijanı) tutmağa məxsus yaylı bağ.

**QASIQOTU** *is. məh. bot.* Sarımtıl-yaşıl rəngli çoxillik ot-bitki. *Qasıqotu odunlaşmış kökə malikdir. Qarşı-qarşıya düzülmüş, kənarı bütöv və kiçik yarpaqları vardır, sarımtıl-yaşıl rəngli xırda çiçəkləri yarpaqlarının qoltuğunda yerləşmişdir.* Əliyev.

**QASILMAQ** *məch.* 1. Parçanın qırağı qatlanıb tikilmək, köklənmək.

2. Çəkilib daralmaq, qısalmaq.

**QASIRĞA** *is.* Ardı kəsilmədən fırlanıb havaya qalxan çox şiddətli, iti külək; tufan, boran. *Pozmamışdır vüqarını nə qasırğa, nə tufan.* S.Rüstəm. *Biz tufanda, qasırğada qayalarda külüng vurduq; Hər dalğanın üstündə biz hər gün yeni buruq qurduq.* Z.Xəlil. ☐ **Qasırğa kimi** – çox şiddətli və iti (sürətli). [Çapqınçılar] *gözlənilməz bir qasırğa kimi bir anda qopub qarşılarına çıxan hər şeyi çapıb talayır və yox olurdular.* M.Rzaquluzadə.

**QASIRĞALI** *sif.* Tufanlı, boranlı. *Qasırğalı hava. – Dəniz qasırğalı, dəniz əsəbi; Dağ kimi dalğalar verib əl-ələ.* O.Sarıvəlli. // *məc.* Coşqun, gurultulu. *Qasırğalı ömür verib; Qocaltmışdı onu dövran.* N.Rəfibəyli.

**QASİB** *sif.* və *is.* [*ər.*] *köhn.* Qəsb edən, zorla alan. *Zavallı müsəlmanlar bir neçə sərsəri qasiblərin əlində baziçə qalmışlar.* A.Səhhət.

**QASİD** *is.* [*ər.*] *köhn.* Xəbər və ya məktub aparıb-gətirən adam; elçi, çapar. *Qasid! Tezcə yardan gətir bir xəbər; Ol güli-xəndanım*

*neçin ağlayır?* M.P.Vaqif. *Yoxdu qasidim, göndərim pəyam; Yarə dərdimi eyləyim əyan.* Nəbati. *Qasid xəbər gətirib ki, buradan başqa gələsi yolları yoxdur*. M.F.Axundzadə.

**QASİDLİK** *is. köhn*. Qasidin işi; məktub və ya xəbər aparıb-gətirmə işi. *Qoyma dəxi onda gedəsən sən; Qasidliyi ona edəsən sən.* Xətayi.

**QASNAQ** *is.* 1. Sağalmaq üzrə olan yaranın üzündə əmələ gələn qabıq, köz. *Yaranın qasnağını qoparmaq*. // Yaş torpaq quruduğu zaman üzündə əmələ gələn nazik, kövrək təbəqə. *Torpaq qasnaq bağlamışdır*.

2. Ələk, xəlbir və s. bu kimi şeylərə keçirilən çənbər.

◊ **Yarasının qasnağını qoparmaq** – b a x **yarasını təzələmək** (“**yara**”da).

**QASNAQLAMA** “Qasnaqlamaq”dan *f.is.*

**QASNAQLAMAQ** *f.* 1. Qasnaq bağlamaq, köz bağlamaq (yara). // Üzü bərkimək, nazik qabıq bağlamaq.

2. Ələk, xəlbir və s. bu kimi şeylərə qasnaq (çənbər) keçirmək.

**QASNAQLANMA** “Qasnaqlanmaq”dan *f.is.*

**QASNAQLANMAQ** *məch.* Qasnaq (çənbər) keçirilmək.

**QASNAQLANMIŞ** *f.sif.* Qasnaq bağlamış.

**QASNAQLI** *sif.* Üzündə qasnaq olan, qasnaq bağlamış.

**QASTRÍT** [*yun.*] *tib*. Mədənin selikli qişasının iltihabı, mədə katarı.

**QASTRÓL** *is.* [*alm.*] Başqa şəhərlərdən və ya ölkədən gəlmiş artistin, yaxud teatrın, sirkin və s. tamaşası. *Paytaxt artistlərinin qastrolu. Artistləri qastrola dəvət etmək.* – [Əmirxan:] *Gündə bir qastrol, bir müsamirə... Bəs soyutmayacaq səni evindən?* S.Vurğun. [Artistlər] *Dərbənddə qastrol verib geri qayıdırdılar.* S.Rəhman.

**QASTROLÇU** *is.* 1. Başqa şəhərlərdən gəlib çıxış edən, ya tamaşa verən artist.

2. *məc. dan.* İş yerini tez-tez dəyişən, qeyri-ciddi, təsadüfi işçi haqqında. *O, işçi deyil, qastrolçudur*.

**QASTROLÇULUQ** *is.* 1. Qastrolçunun işi, qastrol verməsi, qastrolda olması.

2. *məc.* İş yerini tez-tez dəyişdirmə, bir yerdə çox qalıb işləməmə, işə ciddi yanaşmama, ayaqüstü iş görmə.

**QASTRONÓM** [*fr.*] Yeyinti malları mağazası.

**QASTRONÓMİYA** [*fr.*] Yeyinti malları. *Qastronomiya mağazası.*

**QAŞ** *is.* 1. İnsanın gözləri üstündə qövs şəklində uzanan tüklərdən ibarət xətt. *Qara qaş. Çatıq qaşlar* (bitişik qaşlar). *Qələm qaş* (incə və gözəl cizgili qaş). *Kaman qaş* (qövs şəkilli qaş). *Qaşı kaman* (qaşları qövs şəklində olan). – *Ey könül, qədrini bil oxlarının sinəmdə; Edib ol qaşı kəman bunları ənam sənə.* S.Ə.Şirvani. *Qara at nalı neylər; Qara qaş xalı neylər; Vəfalı yarı olan; Dövləti malı eylər*. (Bayatı). □ **Qaş aldırma, qaş alma** – qaşın artıq tüklərini dartıb çıxarma əməliyyatı. *Kiçikbəyimi tay-tuşu ilə bərabər gəlin hamamına apardılar, sonra qaş alma və xına qoyma oldu.* Çəmənzəminli.

2. Üzüyə taxılan qiymətli daş. *Üzük qaşı. Firuzə qaş. Bu üzüyün qaşı brilyantdır.* // Bir şeyin üzərinə vurulan qaşa oxşar bəzək. *Xəncərin qaşı.*

3. Yəhərdə: qaltağın dalında və qabağındakı çıxıq dik. *Abbas kişi dolu bir heybə hazırlayıb yəhərin qaşına saldı.* Mir Cəlal. *Atlı yəhərin qaşından tutub bütün vücudu ilə səs gələn səmtə döndü*. M.Hüseyn. *At ağacların yanından sivişib keçdikcə yəhərin qaşına sindi.* İ.Şıxlı.

4. Dağın, dərənin, təpənin qabaq tərəfi, təpədən aşağı yeri. *Nəbi Həcəri atın tərkinə alıb, Gorus qaşlarıynan oxuya-oxuya Keçəl dağa tərəf getdi.* “Qaçaq Nəbi”. *Təpənin lətif otlarla döşənmiş seyrək ağaclı qaşı ilə yeriyir*(*dim*). A.Şaiq.

◊ **Qaş qaralmaq** – qaranlıq çökmək, qaranlıq qovuşmaq. *Yalnız Musa kişinin bacasından tüstü çıxmır, qaş qaralanda qapısında işıq görünmürdü.* M.İbrahimov. *Dördüncü gün qaş qaralarkən Rizvan ailəsi ilə kəndə qayıtdı.* S.Hüseyn. *Qazanxan, ardınca əlli-altmış atlı, qəsrə çatanda artıq qaş qaralırdı.* M.Rzaquluzadə. **Qaş oynatmaq** – naz-qəmzə etmək, qaşı ilə işarə etmək. *Qarşıdan bir sona keçdi; Oğrun baxdı, qaş oynatdı; Müjganları cana keçdi.* Aşıq Ələsgər. **Qaşları düyülmək (çatılmaq)** – b a x **qaşlarını çatmaq**. *Məsum kişinin .. qaşları düyüldü.* Mir Cəlal. *Təəccübdən Bayramın qaşları çatıldı*. M.Hü-

seyn. *Əsgərlərin miz üstünə əyilmişdir başları; Qəzəbdənmi, kədərdənmi çatılmışdır qaşları*. Ə.Cəmil. **Qaşlarını çatmaq** – dərin fikrə dalaraq, yaxud hiddətlənərək qaşlarını yığmaq, qaşqabağını sallamaq. *Füzuli çataraq sıx qaşlarını; Leylinin eşqinə saldı Məcnunu.* S.Vurğun.

**QAŞ-DAŞ** *is.* Qiymətli daşlar: qızıl və cavahirat. [Gültəkin:] *Mənim üçün nə paltarın, nə də qaş-daşın qiyməti yoxdur.* C.Cabbarlı. *Günlərin birində Qaraçı vəhşiyə deyir ki, kontordan qaş-daş oğurlamışam*. H.Sarabski.

**QAŞ-GÖZ** *is.* Qaşlar və gözlər. *Qaş-gözü qara oğlan*. – *Can qurban eyləsən, layıqdı, layıq; Bir yar ki, mətləbi tez qanan ola; İşarətlə, qaş-göz ilə anlaya; Nəinki deməklə söz qanan ola*. Aşıq Ələsgər. ☐ **Qaş-göz atmaq (oynatmaq), qaş-gözlə danışmaq** – naz-qəmzə etmək. *Qaş-gözün atanda ciyər qan olur; Zülf sevəndə nə din, nə iman olur.* M.P.Vaqif. *Danışdı qaş-göz ilə, hər ötən naəhl ilə zalim; Şikəstə Zakiri gördükcə ox çəkdi, kaman tutdu.* Q.Zakir. **Qaş-göz eləmək** – qaşlarını və gözlərini oynatmaqla işarə etmək, bir şey bildirmək. *Səməd üzünü Məşədi Heydərə tutub qaş-göz elədi*. B.Talıblı. **Qaşla göz arasında** – bir anda, göz yumub açınca. *Qaşla göz arasında evə gedib qayıtdı. Qaşla göz arasında yox oldu.*

**QAŞIQ** *is.* 1. Duru, qatı və ya dənə halında olan xörəyi qabdan götürüb yemək üçün ağac və ya metal alət. *Xörək qaşığı. Çay qaşığı. Taxta qaşıq. Gümüş qaşıq.* – *Ağsaqqal həkim qaşıq tapıb Dəmirova bir xörək qaşığı acı dərman içirtdi.* S.Rəhimov.

2. Bir qaşıq dolusu, bir qaşığın tutduğu miqdar. *Bir qaşıq dərman. İki qaşıq un.* ☐ **Bir qaşıq** *məc.* – bir az, cüzi miqdarda. *Bir qaşıq şorba içdim. Bir qaşıq su ver.* – *İstilik, soyuqluq, qaranlıq, işıq; Azalmır bir qaşıq, artmır bir qaşıq...* M.Araz.

3. *mus*. İçərisi xırda zınqırovlarla doldurulmuş, ağzı qapalı, iki iri qaşıq biçimli qabın silkələnməsi yolu ilə səslənən zərbli musiqi aləti.

**QAŞIQAŞI** *is.* Qaşıq ilə yeyilən duru xörək.

**QAŞIQÇI** *is.* Qaşıq qayıran usta.

**QAŞIQXÖRƏYİ** b a x **qaşıqaşı**. *Dostum .. dolmaya əlini də vurmurdu:* – "*Qaşıqxörəyi olmursa, çörək yeyə bilmirəm*", – *dedi*. Qantəmir.

**QAŞIQLAMA** "Qaşıqlamaq"dan *f.is.*

**QAŞIQLAMAQ** *f.* 1. Qaşıq ilə götürmək, qaşıq ilə götürüb yemək; qaşıq ilə alıb dadına baxmaq. // *məc.* Acgözlüklə yemək. [Məcid kişi:] *İsti xörəyi qaşıqlayanda üfürməmiş udma, hər işdə səbirli ol*. İ.Məlikzadə.

2. Qaşıq ilə qarışdırmaq.

**QAŞIMA** "Qaşımaq"dan *f.is.*

**QAŞIMAQ** *f.* 1. Bədənin gicişən yerini dırnaq və ya sərt bir şey ilə sürtmək, cırmaqlamaq, dırnaqlamaq. *Başını qaşımaq. Dalını qaşımaq.* – *Qapıçıdan soruşdum:* "*Filankəs mənzilindədirmi?*" *Dedi:* "*Buyurun, mənzildədir!*" *Və cavab vermədən qabaq ikiqat baş əyib, iki barmağı ilə boynunun ardını qaşıdı.* Ə.Haqverdiyev.

2. Qazımaq, qazıyıb təmizləmək, sıyırmaq. *Taxtanın üstünü qaşımaq*.

**QAŞINDIRMA** "Qaşındırmaq"dan *f.is.*

**QAŞINDIRMAQ** *icb.* Qaşınma hissi doğurmaq, gicişdirmək, qıcıqlandırmaq. *Gicitkən toxunduğu yeri qaşındırır.*

**QAŞINMA** 1. "Qaşınmaq"dan *f.is.*

2. *is.* Gicişmə, qaşınmaq ehtiyacı. *Bədənimdə qaşınma var.*

**QAŞINMAQ** 1. *f.* Gicişmə hiss etmək, gicişmək. *Bədənim qaşınır*.

2. *qayıd*. Dırnaqla və ya bərk bir şeylə bədənin gicişən yerini qaşımaq. [Allahqulu:] *Biz kötəksiz məgər dolana bilərik? Belimiz adət eləyib. İki gün kötək dəyməyəndə bədənimiz qaşınmağa başlayır.* Ə.Haqverdiyev.

**QAŞINTI** *is.* 1. B a x **qaşınma** 2-ci mənada.

2. Taxta və s.-dən qaşınıb tökülən xırım-xırda. *Təknənin qaşıntısı. Ət taxtasının qaşıntısı*.

**QAŞITMA** "Qaşıtmaq"dan *f.is.*

**QAŞITMAQ** *icb.* Qaşınmasına səbəb olmaq; qaşınma ehtiyacı doğurmaq.

**QAŞQA** *is.* 1. Ümumiyyətlə, mal-qaranın, xüsusilə at, inək və öküz kimi iri ev heyvanlarının alnındakı ağ ləkə. // *sif.* Alnında qaşqası olan. *Qaşqa inək. Qaşqa day. Qaşqa dana.* – [Pəricahan xanım:] *Qaşqa at altımda qoruqdan gəlirdim*. S.S.Axundov. *Əqlin baltasıyla vurdu başından; Sındırdı öküzün buynuzlarını;*

*Milyon il dedilər: – Qaşqa öküzlə; Çatıbdır şöhrətə, şərəfə dünya*. B.Vahabzadə.

2. *məc.* Alnın tam ortası. *Ovçu quşu qaşqasından vurmuşdu. – Qaşqası böyük olanın sözü çox danışılar.* (Ata. sözü). *Qızdırmalı bir bayqınlıq içində Tərlanın alnındakı qaşqanı yaxından nişan alıb, tətiyi çəkdim.* Ə.Məmmədxanlı.

**QAŞQABAQ** *is.* Acıqlı, hirsli və ya bir şeydən narazı olan adamın üzündə əmələ gələn hal; qaşların çatılması və alnın qırışdırılması. *Xudayar bəy qaşqabaq ilə cavab verdi*. C.Məmmədquluzadə. □ **Qaşqabağı açılmaq** – üzündə fərəh əlaməti görünmək; açığı, hirsi soyuyaraq üzü açılmaq. [Hacı Murad:] *Bəs niyə heç qaşqabağın açılmır?* S.S.Axundov. *Qızın .. üzündə qəzəb və hiddət bir anda silindi. Qaşqabağı açıldı*. M.Rzaquluzadə. **Qaşqabağı yer altından (yer ilə) getmək** – həddən artıq hirsli, acıqlı olmaq. *Tükəzban qayət hirsli olaraq içəri daxil oldu. Nədənsə ovqatı çox təlx idi; qaşqabağı yer altından gedirdi.* B.Talıblı. **Qaşqabağını sallamaq (turşutmaq, tökmək)** – qaşlarını çataraq və alnını qırışdıraraq, öz sifətinə acıqlı, yaxud narazı bir ifadə vermək. *Sözlərini qurtaran kimi Səməd yenə qaşqabağını sallayıb, sükuta gedərdi.* Çəmənzəminli. *Bu dəmdə Məstan bəyin keçmiş nökəri çolaq Məcid daxil oldu, Məstan bəy qaşqabağını tökdü.* B.Talıblı. **Qaşqabaq göstərmək** – pis qarşılamaq, acıqlı qarşılamaq. *Şəksiz səninlə ədavəti var; Onunçun göstərir qaşqabaq sənə*. Q.Zakir.

**QAŞQABAQLI** *sif.* Acıqlı, hirsli, tutqun üzlü. [Sərxan] *gələndə ən qaşqabaqlı adamların belə dodağı qaçırdı.* M.İbrahimov. [Tükəzban] *əvvəlki kimi qaşqabaqlı* (z.) *gəlib öz yerində oturdu*. B.Talıblı. [Yalıncaq bəyin] *üst-başı toz-torpaq içində, özü .. qaşqabaqlı və kədərli idi*. M.Rzaquluzadə. // *məc.* Çox tutqun. *Yuxarıda kol-koslu qayalıqlar, bunların da üstündə qara buludlar oynaşan qaşqabaqlı göy görünürdü.* Çəmənzəminli.

**QAŞQABAQLILIQ** *is.* Qaşqabaqlı adamın hal və keyfiyyəti.

**QAŞQAL** *is. məh*. Xır bağlanan zaman, suyu paylaşdırmaq üçün bir neçə yerdən deşilib, suyun ağzına qoyulan ağac parçası.

**QAŞQALAŞMAQ** *f. məh*. Toqquşmaq, bir-biri ilə sözləşmək, çəkişmək, tutaşmaq, deyişmək. *Ay yoldaşlar, sizə bir söz söyləyim; Kəndlilərlə qaşqalaşdı mollalar.* Aşıq Mirzə.

**QAŞQALDAQ** *is. zool*. Əti yeyilən qara rəngli, ördəyə bənzər su quşu. *Pirallahıdan bu yanda balaca bir ada var, bir dəfə atam ora qaşqaldaq ovuna getmişdi, məni də aparmışdı..* Ə.Məmmədxanlı.

**QAŞLAMAQ** *f.* Üzüyə qaş taxmaq.

**QAŞLATMAQ** *icb.* Üzüyə qaş taxdırmaq.

**QAŞLI** *sif.* Qaşı olan. b a x **qaş** 2 və 3-cü mənalarda. *Qaşlı üzük. Qaşlı yəhər. – Səadət xanım Gülnazı .. Laləzara apardı. Parça mağazalarını, ətriyyat və daş-qaş dükanlarını gəzdirdi. Hətta almaz qaşlı bir üzük də alıb barmağına taxdı.* M.İbrahimov.

**QAŞOTU** *is. bot*. Dağlıq yerlərdə, çəmənlərdə bitən çoxillik ot bitkisi.

**QAŞOV** *is.* Heyvanların tozunu, çirkini qaşıyıb təmizləməyə məxsus dəmirdən düzəldilmiş dişli alət. *Malları hər gündə iki dəfə şotka və qaşov ilə təmiz edib, iki dəfə də onların altının otlarını dəyişdirirlər*. "Əkinçi". □ **Qaşov çəkmək** – b a x **qaşovlamaq** 1-ci mənada.

**QAŞOVLAMA** "Qaşovlamaq"dan *f.is.*

**QAŞOVLAMAQ** *f.* 1. Heyvanın qaşov ilə tozunu, çirkini təmizləmək. *Donqarınla donqar ayı; Qaşovlandı bütün yayı; Boz qaban ağzı dolayı... Palıd, səni kim yıxdı?* M.Araz.

2. *məc. dan*. Ruhən incitmək, ruha əzab vermək (pis çalğıçı və ya qaba səslə oxuyan haqqında).

**QAŞOVLANMA** "Qaşovlanmaq"dan *f.is.*

**QAŞOVLANMAQ** *məch.* Qaşov çəkilmək, qaşovla təmizlənmək.

**QAŞOVLATMA** "Qaşovlatmaq"dan *f.is.*

**QAŞOVLATMAQ** *icb.* Qaşov çəkdirmək. *Atı qaşovlatmaq*.

**QAT** *is.* 1. Üfüqi vəziyyətdə bir-birinin üstündə yerləşən cismin laylarından hər biri; lay, təbəqə. *Torpağın alt qatları. Yer kürəsinin dərin qatları. Havanın üst qatları. – Bir sıra neftli sahələrin dərin qatlarında olan neft layları hələlik tədqiq edilməmişdir.* M.Qaşqay. // Qədim təsəvvürə görə, göyün qübbələrini təşkil edən hər təbəqədən biri. □ **Göyün (göylərin) qatı** – çox uca mənasında. *Göylərin qatına ucaldı fəryad; O qır-*

*ğın Qafqazda tutar qoymadı.* S.Vurğun. *Fələki dolanır göyün qatını*. M.Rahim.

2. Mərtəbə. *Tövlə evin alt qatında idi*. S.Hüseyn. *Yeddimərtəbə binanın üçüncü qatında balkonu küçəyə baxan mənzil xüsusi bir səliqə ilə düzəlmişdi.* S.Rəhimov.

3. Bükülmüş parçanın, kağızın və s.-nin hər bükümü. *Parçanı dörd qat qatladım.* // Büküş yeri, qırış. *Bu parçanı qat kəsmişdir*. // İpdə tel, burum. *İpin qatını açmaq*.

4. Dəfə, kərə (adətən rəqəmlərlə). *Saldıqca cavanlıqda keçən günləri yadə; Dərdim olur on qat.* M.Ə.Sabir.

◊ **Dalı qatda, arxası qatda** – dal tərəfdə, arxa tərəfdə, arxası üstdə. *Şahsənəm dönüb Qəribi dalı qatda görən kimi atılıb, boynuna sarıldı.* "Aşıq Qərib".

**...qat** – qoşulduğu sayın göstərdiyi qədər çox mənasında mürəkkəb sifət düzəldilir; məs.: birqat, ikiqat və s.

**qat-qat** *zərf* 1. Üfüqi halda bir neçə təbəqə; lay-lay, çin-çin, təbəqə-təbəqə. *Qat-qat yığılmış kitab. Qat-qat yoğurulmuş fətir*. // Qatlar, laylar halında. *Bitki materiallarını qurudarkən onları qat-qat nazik halda sərib gündə 1-2 dəfə çevirirlər.* Əliyev.

2. Bir neçə dəfə, dəfələrlə. *Qat-qat artıq. Qat-qat üstün. Qat-qat yaxşı. – Dərsə xan sevinəcək, öyünəcək, oğluna məhəbbəti qat-qat artacaqdır.* M.Rzaquluzadə. *Özlərindən qat-qat çox olan kərtənkələ rəngli düşmənlə əlbəyaxa, ölüm-dirim çarpışmasında idilər.* Ə.Əbülhəsən.

**QATANQAZ** *sif.* 1. Kobud, cod, qatlanmaz, çətin bükülən. *Palazı suya saldıqda, taxta kimi qatanqaz olur*.

2. Çirkdən, kirdən codlaşmış, sərtləşmiş (paltar və s. haqqında). *Əynindəki köynək lap qatanqaz olmuşdur.*

**QATAR[1]** *is.* 1. Bir-birinin ardınca sıralanmış heyvanlar düzümü; qafilə, karvan. *Durna qatarı. Dəvə qatarı. – Təsbeh kimi qatarınız düzərsiz; Havalanıb ərş üzündə süzərsiz*. M.V.Vidadi. *Qanad çalıb göylərdə süzür durna qatarı.* M.Seyidzadə. // Ümumiyyətlə, bir-birinin ardınca düzülmüş şeylər sırası; cərgə, sıra, səf. [Ağa Kərim xan:] *Qatar durun! Adbaad hər nə ki, sizə buyuracağam, o, bu gün gərək cabəca əmələ gəlsin*. N.Vəzirov. // *Zərf mənasında.* Qatarla, sıra ilə, cərgə ilə. *Samovarın yanında, divara qatarla xırda mıxlar vurub, xırda podnoslar asardılar.* H.Sarabski. *Qatarla düzülmüş küknar ağacları asta-asta yırğalanır*. O.Sarıvəlli.

2. Dəmiryol vaqonları düzümü. *Yük qatarı. Sərnişin qatarı. – O qatar gəlib ötməli, sonra da bunlar getməli idilər.* S.Rəhman. *Bakıdan yanacaq, Sibirdən ağac; Yüz qatar boşalır, yüz qatar gəlir*. R.Rza.

3. Bir qayış üzərinə düzülmüş patron sırası; patrondaş. *Kəmərlərində qılınclar, çiyinlərində tüfəng; Boyunlarında həmayil, iki qatar da fişəng.* A.Səhhət. *Qoçular, quldurlar qatar taxardı; Kimi istəsəydi, vurar yıxardı.* Aşıq Ələsgər.

**qatar-qatar** *zərf* Qatar halında, bir-birinin ardınca sıralanmış halda; dəstə-dəstə, cərgə-cərgə, sıra-sıra. *Qatar-qatar olub, qalxıb havaya; Nə çıxıbsız asimanə, durnalar!* M.V.Vidadi. *Alay-alay, qatar-qatar qəhrəmanlar çıxdı yola.* S.Vurğun. *Gedir qərbə tərəf hücum çəkənlər; Gedir qatar-qatar bombatökənlər*. M.Rahim.

**QATAR[2]** *is.* [*ər.*] *mus*. Azərbaycan klassik muğamlarından birinin adı; kiçik həcmli vokal-instrumental muğam. *Qatar üstə oxumaq. Qatar rəngi.*

**QATARI** *sif.* və *zərf* Qatarla, qatar kimi, yan-yana sıralanmış. *Sanasan pələngdən balü pər düşüb; Düzülüb dalında qatarı tellər.* M.P.Vaqif.

**QATARLAMA** "Qatarlamaq"dan *f.is.*

**QATARLAMAQ** *f.* Adamları, heyvanları, yaxud şeyləri bir-birinin ardınca düzüb qatar düzəltmək.

**QATARLANMA** "Qatarlanmaq"dan *f.is.*

**QATARLANMAQ** b a x **qatarlaşmaq**. *Arazdan qalxan duman dəvə karvanı kimi qatarlanır..* S.Rəhimov.

**QATARLAŞMA** "Qatarlaşmaq"dan *f.is.*

**QATARLAŞMAQ** *f.* Qatar düzülmək, qatar bağlamaq (b a x **qatar[1]** 1 və 2-ci mənalarda). *Qatarlaşıb nə diyardan gəlirsiz? Bir xəbər versəniz bizə, durnalar!* M.P.Vaqif. *Dəstə ilə uçan quşlar dağınıq halda və ya müəyyən nizamla uçurlar. Məsələn, durnalar küt bucaq şəklində qatarlaşıb uçurlar.* "Zoologiya".

**QATARLI** *sif.* 1. Qatarı olan.

2. *Zərf mənasında*. Boynunda, ya belində patron qatarı (patrondaşı) olduğu halda; patrondaşlı. [Veys:] *Tüfəngli, qatarlı, qollarınızda qırmızı, hansı dövlətlinin qapısından girsəniz, nəfəsi kəsiləcək!* Ə.Əbülhəsən.

**QATBAQAT** bax **qat-qat**. *Milləti gördükcə belə hərcü mərc; Könlüm olur dopdolu qan qatbaqat.* M.Ə.Sabir. *Fikrim açılır hərdən; Göz önümdə qatbaqat.* B.Vahabzadə.

**QATDALAQ** *is. məh*. Dalaq şişməsi xəstəliyinin xalq arasında adı.

**QATDIRMAQ** "Qatmaq"dan *icb. Suvağa su qatdırmaq*.

**QATI** *sif.* 1. Sıyıq, duru olmayan; mət, qəliz. *Qatı palçıq. Qatı şərbət. Qatı şorba. Qatı kütlə. Qatı mürəkkəb. Qatı mürəbbə.*

2. Sıx, kəsif, qəliz. *Qatı tüstü. Qatı duman. – Alaçıqların bəri yanından nazik, lakin qatı çən zolağı uçub haraya isə gedirdi.* M.Hüseyn. *Qaranlıq o qədər də qatı deyildi, evlər, ağaclar seçilirdi.* S.Rəhman. *Dünyamız o qədər qatı dumanda; Gözləri tor bağlar ulduzların da.* M.Araz.

3. *məc.* Çox şiddətli, çox güclü, çox bərk. *Qatı soyuq*. – *Qatı müştaq olmuşam zülfü üzarın buyinə*. Nəsimi. *Dərdim qatıdır bu gecə lütf eylə, ey dust! Mən bidilü biçarəvü bimarı unutma*. Kişvəri. *Lakin küçədə gəzişib, azad danışmaq üçün yalnız qatı soyuqlar deyil, xalqın gediş-gəlişi də mane olurdu.* M.S.Ordubadi.

4. *məc.* Sərt, rəhmsiz, amansız, qəddar. *Qatı ürək*. – [Qacar:] *Görürsən? O imiş qatı düşmənim; Onu yandırsam da haqqım var mənim.* S.Vurğun. *Bu teleqram bir daha o məqsədin son dərəcə vəhşi, amansız və qatı olduğunu anladırdı.* M.S.Ordubadi.

**QATIAÇILMAMIŞ** *sif.* Qat-təzə (parça, paltar haqqında).

**QATIQ** *is.* 1. Südü bişirib, bir qədər soyutduqdan sonra, içərisinə maya qataraq, üstünü basdırmaqla hazırlanan ağartı; yoğurt. *Üzlü qatıq. Üzsüz qatıq. Qatıq çalmaq* (süddən qatıq hazırlamaq). *Üç gündür yol gəlirəm, acam, mənə bir az qatıqdan, əppəkdən verərsinizmi?* M.Rzaquluzadə.

2. Çörək ilə bərabər, çörəyə qatılıb yeyilən hər bir şey; yavanlıq. *Qatıqsız çörək boğazdan keçməz*.

**QATIQAŞI** *is.* Buğda yarmasından, yaxud düyü, göyərti və ətdən hazırlanaraq qatıqla yeyilən sadə yemək; yoğurtaşı.

**QATIQÇI** *is.* Qatıq hazırlayıb satan adam.

**QATIQDOĞRAMASI** *is.* Doğrama(c).

**QATIQQUYMAĞI** *is. köhn*. Xalq təbabətində: xəmiri yağda qovurduqdan sonra, üzərinə bir az qatıq, ya ayran töküb yaranın, çibanın üstünə qoyulan yaxı; yaxma dərman.

**QATIQLAMA** "Qatıqlamaq"dan *f.is.*

**QATIQLAMAQ** *f. dan*. Qatıq qatmaq, qatıq sürtmək, qatıq yaxmaq; xörəyin və s.-nin üstünə qatıq tökmək, qatıqla dada gətirmək.

**QATIQLANMA** "Qatıqlanmaq"dan *f.is.*

**QATIQLANMAQ** *məch.* Qatıq qatılmaq, qatıq sürtülmək, üstünə qatıq tökülmək.

**QATIQLAŞDIRILMA** "Qatıqlaşdırılmaq"-dan *f.is.*

**QATIQLAŞDIRILMAQ** *məch.* Qatıq halına salınmaq, xarab edilmək.

**QATIQLAŞDIRMA** "Qatıqlaşdırmaq"dan *f.is.*

**QATIQLAŞDIRMAQ** *f.* Südü saxlayıb, xarab etmək, qatıq halına salmaq, laxtalaşdırmaq.

**QATIQLI** *sif.* Qatıq vurulmuş, qatıq vurulan, qatıqla yeyilən. *Qatıqlı qayğanaq. – Plovun üstündə də bir mis sərpuş, yanında da bir boşqabın içində üstü qatıqlı yarpaq dolması qoyulardı*. H.Sarabski.

**QATIQOTU** *is. bot.* Tərkibində efir yağı olan iri köklü bitki.

**QATIQSATAN** *is.* Qatıq satmaqla məşğul olan adam. *Bu gün həyətə qatıqsatan gəlmişdi. – Çapdılar obaya, ey qatıqsatan; Hər eyməyə tökmüşdülər üç qazan*. Q.Zakir.

**QATILANMA** "Qatılanmaq"dan *f.is.*

**QATILANMAQ** *f.* Qatı olmaq, qatı hala gəlmək, qatılaşmaq.

**QATILAŞDIRILMA** "Qatılaşdırılmaq"dan *f.is.*

**QATILAŞDIRILMAQ** *məch.* Daha qatı edilmək, daha qatı hala salınmaq; qəlizləşdirilmək, kəsifləşdirilmək.

**QATILAŞDIRMA** "Qatılaşdırmaq"dan *f.is.*

**QATILAŞDIRMAQ** *f.* Daha da qatı etmək, yaxud duru halda olan şeyi qatı hala salmaq; qəlizləşdirmək, kəsifləşdirmək. *Suvaq üçün tutulan palçığı bir az qatılaşdırmalı*.

**QATILAŞMAQ** *f.* 1. Getdikcə qatı hala düşmək, getdikcə bərkimək, qəlizləşmək; mət-

ləşmək. *Qatıq qalıb qatılaşıbdır. Mürəkkəb lap qatılaşıb, yazmaq olmur. Mürəbbə odun üstündə çox qalıb qatılaşdı.*

2. Getdikcə artmaq, şiddətlənmək, güclənmək; kəsifləşmək. *Axşam qaranlığı isə qatılaşır, sanki Nərimanın havaxdan bəri həsrət olduğu gündüz işığını örtmək istəyirdi.* Mir Cəlal. *Çən get-gedə daha da qatılaşırdı.* M.Hüseyn. *Çöldə qaranlıq daha da qatılaşmışdı.* S.Rəhman.

**QATILAŞMIŞ** *f.sif.* Qatı hala gəlmiş, qəlizləşmiş, kəsifləşmiş. *Qatılaşmış şorba. – Çox vaxt quyudan çıxan qatılaşmış məhlulun özlülüyünü su əlavə etməklə azaltmaq lazım gəlir.* Quliyev.

**QATILATMAQ** *icb.* Qatı hala saldırmaq.

**QATILI** *sif.* Qatışığı olan, tərkibinə başqa şey qatılmış olan; xalis və saf olmayan.

**QATILIQ** *is.* 1. Qatı şeyin halı, xassəsi; bir şeyin bərkliyi ilə mayelik arasında olan halı (*sıyıqlıq*, *duruluq* ziddi).

2. Sıxlıq, kəsiflik, qəlizlik.

3. Şiddət, şiddətlilik, sərtlik.

4. *məc.* Mərhəmətsizlik, rəhmsizlik, amansızlıq. *Hər kimin daş kimi yoxdur ürəyində qatılıq; Millətin halını gördükdə gərəkdir yansın; Dərdinə qalmağı daim özünə borc sansın.* A.Səhhət.

**QATILIŞ** *is.* Qatma (qatılma) işi.

**QATILMA** "Qatılmaq"dan *f.is.*

**QATILMAQ** *f.* 1. Qarışmaq, qoşulmaq, birləşmək; bir kütlənin içərisinə daxil olmaq. *Camaata qatılıb getdi. Mal mala qatıldı.*

2. *məch.* Qarışdırılmaq. *Bir-birinə qatılmaq. Sirkəyə su qatılmışdır.*

**QATILMIŞ** *f.sif.* Əlavə edilmiş, daxil edilmiş, qarışdırılmış. *Su qatılmış süd. Şəkər qatılmış xəmir.* – [Ömər koxa] *buğlanan çaya, bal qatılmış qaymağa, motal pendirinə və sacın üstündən yenicə götürülmüş isti ağ fətirə gözucu nəzər saldı.* İ.Şıxlı.

**QATIM** *is.* Qatma, qarışdırma, qatışdırma.

◊ **Qatım-qatım qatlamaq** – tamamilə əldən salmaq, əzmək. *Bir yandan Koroğlu, bir yandan Qırat, az vaxtda dəstəni qatım-qatım qatlayıb əldən-ayaqdan saldılar.* "Koroğlu".

**QATIR** *is.* Eşşəklə madyanın cütləşməsindən törəyən yük heyvanı. *Kənd təsərrüfat heyvanlarından at, öküz, qatır, dəvə və sairədən qoşqu qüvvəsi kimi istifadə olunur.* – [Fərhad:] *Əmi, bu yüklü qatırlar nədir qapıda dayanıblar?* Ə.Haqverdiyev. *..Azuqə tədarük edib boz qatıra yüklədim, yola düşdüm.* S.S.Axundov.

**QATIRÇI** *is. köhn.* Qatır saxlayıb kirə ilə işlədən adam.

**QATIRÇILIQ** *is. köhn.* Qatırçı sənəti. [Hacı Nuru:] *Onun da səbəbi var, ondan ötrü ki, sən çox yaxşı qatırçılığa layiqsən.* M.F.Axundzadə.

**QATIRDIRNAĞI** *is. bot.* Sarı çiçək açan yabanı bitki. *Murad yerdən boy atmış uzun bir qatırdırnağı üzdü.* İ.Əfəndiyev.

**QATIRXANA** *is. köhn.* Qatır saxlanılan yer, tövlə. *Bir nəfər qışqırdı: – Ağanın qatırxanası hər yerdən yaxşıdır, keşiyi də biz özümüz çəkərik.* P.Makulu.

**QATIRQUYRUĞU** *is. bot.* Bəzi növlərindən dərman hazırlanan çoxillik bataqlıq bitkisi.

**QATIRMUNCUĞU** *is. köhn.* Keçmişdə qatırların boynuna taxılan göy şüşə muncuq.

**QATIŞDIRILMA** "Qatışdırılmaq"dan *f.is.*

**QATIŞDIRILMAQ** "Qatışdırmaq"dan *məch.*

**QATIŞDIRMA** "Qatışdırmaq"dan *f.is.*

**QATIŞDIRMAQ** b a x **qarışdırmaq** 1-ci mənada. [Gülnisə:] *Ana, südlü yaymanı cılxaca süddən bişirim, yoxsa su da qatışdırım?* Ə.Haqverdiyev.

**QATIŞIQ** 1. B a x **qarışıq** 1-ci mənada. *Bu südün qatışığı var. Bu, xalis buğda unu deyil, qatışıqdır.*

2. *is.* Müxtəlif maddələrin qarışığından ibarət olan xəlitə.

**QATIŞMA** "Qatışmaq"dan *f.is.*

**QATIŞMAQ** b a x **qarışmaq**. *Onun sözlərinə qatışma, dilbər; Dəli yola gedər el arasında.* Q.Zakir.

**QATİL** *is.* və *sif.* [*ər.*] Öldürən, adam öldürən, cani. *Qatil öz cəzasına çatdı. – Səfərin qardaşının .. qatili kim olduğu məlum deyildi.* S.S.Axundov.

**QATİLLİK** *is.* Adam öldürmə, canilik. *Balacayevi böyük bir dəhşət bürüdü. Onun boynuna üç təqsir sarınmışdı – saxtakarlıq, israfçılıq və qatillik.* S.Rəhimov.

**QAT-QARIŞ** b a x **qat-qarışıq**. [Katibin] *yazıq-yazıq baxan sönük və qonur gözləri qat-qarış olmuş kağızlara dikildi.* S.Rəhimov.

**QAT-QARIŞIQ** *sif.* Nizamsız, bir-birinə qarışmış, dolaşıq, qarışıq, pozğun. *Qat-qarışıq işlər. Yuxarıda qat-qarışıq bir səs eşidildi.* // Hərc-mərc. *Ballı Dursunun bu vaxtadək gəlib çıxmamasından onun qat-qarışıq günlərdə tələf olduğunu yəqin etdi.* A.Şaiq.

**QAT-QARIŞLIQ** *is.* Qat-qarış şeyin halı.

**QATQATI** *is. bayt.* Gövşəyən heyvanların qarnı ilə qursağı arasındakı həzm üzvü.

**QATQI** *is.* Bir şeyə qatılan başqa maddə; aşqar.

**QATLAMA** 1. "Qatlamaq"dan *f.is.*

2. *is.* Yağda bişirilmiş qat-qat çörək, yağlı fətir. *Gözəl .. atası evinə gələndə azı üç-dörd gün qalırdı. Bu zaman qardaşı arvadları onlar üçün fəsəli və qatlama bişirərdilər.* M.Hüseyn.

3. *sif.* Qatlanan, açılıb-yığılan. *Qatlama nərdivan. Qatlama kürsü, çarpayı. Qatlama yaxalıq. – Xeyli keçdi, əllər sakitləşdi, qatlama skamyalar səsləndi. Ötəri bir sakitlik salonu bürüdü.* S.Rəhimov. *Şirəli kişi anbarın qatlama qapılarını açdı.* S.Rəhman. *Salonda üç qatlama stol açıb bir-birinə bitişdirmişdilər.* Ə.Vəliyev.

4. *sif.* Büzmə, büzmə-büzmə.

**QATLAMAQ** *f.* 1. Bükmək; ikiqat, üçqat və i.a. etmək. *Paltarı qatlamaq. Kağızı qatlamaq. – Vaqifin cavabı xana xoş gəldi. Məktubu qatlayıb qasidə verdilər.* Çəmənzəminli. // Qarmaq, qanırmaq, geri qaytarmaq. *Qolu o qədər qüvvətlidir ki, qatlamaq olmur. Dizini qatlamaq.* // Açıq şeyi örtmək. *Ləbbeyk kitabı qatlayıb əlinə aldı.* Mir Cəlal.

2. Parçanı bir bərabərdə qat-qat edib, hər qatını bir-birinin dalınca tikmək. *Köynəyin yaxasını qatlamaq.*

3. Əymək, bükmək. *Boynunu qatlayıb çiyninə qoymaq.*

**QATLANACAQ** *is. anat.* Dizin dalındakı çuxur.

**QATLANMA** "Qatlanmaq"dan *f.is.*

**QATLANMAQ** *f.* 1. Bükülmək, ikiqat olmaq. *Məftil qatlandı.* // *məc.* Qat-qat bükülmək (paltar və s.).

2. B a x **qatlaşmaq**. *Dildarə müştaq oldu can, anın camalın arzular; Hicranə qatlanmaz könül, yarın vüsalın arzular.* Nəsimi. *O gün mən ağır və ən çətin dəqiqələrə qatlandım.* S.Vurğun. *Qatlanaraq əziyyətə böyütmüşdü balaları.* N.Rəfibəyli.

3. Əyilmək, təzim etmək.

**QATLANMAMIŞ** *f.sif. məc.* Tamamilə təzə, təptəzə, işlənməmiş. [Hacı Salman:] *Hə, hacı yoldaş, .. hamısı qatlanmamış yüzlüklərdir ha!* N.Vəzirov.

**QATLANMAZ** *sif.* Bükülməz, əyilməz.

**QATLANMIŞ** *f.sif.* Bükülmüş; ikiqat, üçqat və i.a. edilmiş. *Xanlar əlini boz parusin köynəyinin cibinə ataraq, səliqə ilə qatlanmış bir vərəqə çıxartdı.* M.Hüseyn.

**QATLAŞMA** "Qatlaşmaq"dan *f.is.*

**QATLAŞMAQ** *f.* Dözmək, tab gətirmək, səbr etmək, istər-istəməz razı olmaq, şikayət etmədən və müqavimət göstərmədən qəbul etmək. *Çətinliyə qatlaşmaq. – Mən gündə seminariyada iyirmi-otuz .. uçitellər ilə əl-ələ vermişəm! Vallah, belə bilsəydim ki, axırı belə olacaq, heç vaxt bu zəhmətlərə qatlaşmazdım.* C.Məmmədquluzadə. [Haşım] *əkirdi, biçirdi və hər bir ağır zəhmətlərə qatlaşırdı.* B.Talıblı. [Telli] *İslamı sevmiş, onun hər cəfasına qatlaşmışdı.* S.Hüseyn.

**QATMA**[1] "Qatmaq"dan *f.is.*

**QATMA**[2] *is.* Kəndir və ya yundan eşilmiş ip. [Hatəmxan ağa:] *Çiyninə bir qatma bağlayıbsan, elə bilirsən ki, heç kəsin sənə əli çatmaz?* Ə.Haqverdiyev. *Yoxsa bura gələndə qılçaların qatma kimi bir-birinə dolaşırdı.* S.Rəhimov. *Məxməri çevirib təmizlədi, çırpdı, kitabı ona büküb qatma ilə bağladı.* Mir Cəlal.

**QATMACA** *is.* Bir şeyə qatılmış özgə şey. *Çox da tərəzi düzəldi və noxud əhvalatı bir qərara qoyuldu, bəs onun qatmacası neçə olsun?!* N.Vəzirov.

**QATMAQ** *f.* 1. Əlavə etmək, qoymaq, birləşdirmək, qoşmaq, içərisinə daxil etmək. *Qoyunu sürüyə qatmaq. – Hər birinə ağır taylar çatdılar; Bizləyə-bizləyə köçə qatdılar.* Q.Zakir. *Gözəldir günəşi, ayı səsləyib; Onları da bizim dəstəyə qatmaq.* M.Müşfiq. *Göz tək bulaqlardan buz tək suları; Axıdıb çaylara qatar, o dağlar.* H.K.Sanılı. ◻ **Qabağına qatmaq** – b a x **qabaq**[2].

2. Qarışdırmaq. *Sirkəyə su qatmaq. Südə su qatmaq. – Aşiqin cigər qanından şərbəti var, ey həkim; Qatma anın şəkkərinə qəndlə innablar.* Nəsimi. *Su, şaraq-şaraq axaraq, daşla qumu bir-birinə qatıb gəlirdi.* M.İbrahimov. ◻ **Qatıb qarışdırmaq** – qarmaqarışıq etmək, bir-birinə qarışdırmaq, dolaş-

dırmaq. [Rəcəb:] *O zaman balası da mənim atmaca sözlərimi özgə cürə yozub, qatıb qarışdırıb..* N.Vəzirov.

3. *dan*. Salmaq, soxmaq. *Yekə kişi, xalqın eşşəyini oğurlayıb gətirmisən, qatmısan mənim karvansarama*. C.Məmmədquluzadə.

4. Bəzi isimlərin qabağına gətirilərək, mürəkkəb feillər və müxtəlif ifadələr düzəldilir; məs.: pər qatmaq, şuluq qatmaq, əl qatmaq.

**QATMA-QARIŞIQ** b a x **qat-qarışıq**.

**QATRAN** *is.* [*ər.*] Bəzi ağaclardan və ya daş kömürdən hasil edilən, sənaye və təbabətdə işlənilən qara rəngli, kəskin qoxulu və yapışqanlı maddə; zift. *Şam qatranı. Qatran iyi.* ◻ **Qatran kimi** – qapqara. *Qatran kimi qara saç. – Camə geyib cümləsi qatran kimi; Zahir olub göz yaşı tufan kimi*. S.Ə.Şirvani.

**QATRANÇI** *is.* Bir şeyə qatran çəkməklə məşğul olan adam.

**QATRANLAMA** "Qatranlamaq"dan *f.is.*

**QATRANLAMAQ** *f.* Su keçməmək, çürüməmək və ya başqa məqsədlər üçün bir şeyin üzünə qatran sürtmək. *Qayığı qatranlamaq. Telefon kabelini qatranlamaq. Dirəkləri qatranlamaq*.

**QATRANLANMA** "Qatranlanmaq"dan *f.is.*

**QATRANLANMAQ** *məch.* Qatran çəkilmək, qatran sürtülmək. *Gəmi ipləri qatranlanmasa, çürüyər. Şalbanların ucları qatranlanmalıdır.*

**QATRANLANMIŞ** *f.sif.* Qatran çəkilmiş, qatran sürtülmüş. *Qatranlanmış dirəklər*.

**QATRANLAŞMA** "Qatranlaşmaq"dan *f.is.*

**QATRANLAŞMAQ** *f.* Qatrana dönmək, qatran halına gəlmək.

**QATRANLATMAQ** *icb.* Qatran çəkdirmək, qatran sürtdürmək. *Su borusunu qatranlatmaq*.

**QATRANLI** *sif.* 1. Qatran sürtülmüş, üstünə qatran çəkilmiş; qatran hopdurulmuş. *Qatranlı şalban. Qatranlı boru. Qatranlı taxta.*

2. Qatran qarışdırılmış.

**QAUPVAXT** *is.* [*alm.*] Hərbi qulluqçular üçün həbsxana.

**QAVAL** *is.* Üzünə dəri çəkilmiş sağanaqdan ibarət zınqırovlu və ya zınqırovsuz musiqi aləti; dəf. *Qaval çalmaq. – Bu əfsanənin mənası budur ki, musiqi – tar, qaval, kamança və bunlara oxşayan çalğılar hamısı şeytan işidir..* C.Məmmədquluzadə.

**QAVALÇALAN** b a x **qavalçı**.

**QAVALÇI** *is.* Qaval çalan adam, dəf çalan adam, dəfçi.

**QAVALÇILIQ** *is.* Qavalçı sənəti.

**QAVALDAŞ** *is.* Qobustanda daş dövrünə yastı ahəngdaşıdan ibarət aid iki abidə. *Qavaldaşdan musiqi aləti kimi istifadə olunmuşdur. – Təbiətin ruhundadır; Bu uyarlıq, bu nəğməlik; Təbiətin özü çalır "qavaldaş"ı.* B.Vahabzadə. *Qoca bundan sonra yenə bu dünyada qalmaq üçün dönmək istəyirdi, o qaval daşa ki, elə bil o daş dünya yaranandan orda, Qobustan çölündə qayalıqlar içində düşüb qalmışdı..* Ə.Məmmədxanlı.

**QAVALVURAN** b a x **qavalçı**. *Qavalvuran oğlan isə boğazını arıtdayıb oxumağa hazırlaşırdı*. M.Hüseyn.

**QAVARA** *is. məh.* Boy-buxun, görkəm. [Hacı Nuru:] *Əgər qatırçılıq etsəydin, bu qavara və zor ilə ildə yüz əlli manata pul deməzdin.* M.F.Axundzadə.

**QAVARALI** *sif. məh*. Boy-buxunlu, görkəmli.

**QAVÓT** *is.* [*fr.*] Qədim fransız xalq rəqsi və bu rəqs üçün yazılmış musiqi əsəri.

**QAVRAMA** "Qavramaq"dan *f.is.*

**QAVRAMAQ** *f.* Başa düşmək, anlamaq, dərk etmək. *Biz cismi nə qədər tam duysaq, onu o qədər tam qavrayırıq. – Get-gedə dincəlməyə və qızın yeknəsəq sözlərini qavramağa başlayırdım*. M.S.Ordubadi. *Kitabda dərin bir analiz və bir çox da fəlsəfi fikirlər vardır ki, oxucu birdən-birə qavraya bilməz*. C.Cabbarlı.

**QAVRAN(IL)MA** "Qavran(ıl)maq"dan *f.is.*

**QAVRAN(IL)MAQ** *məch.* Dərk edilmək, başa düşülmək, anlaşılmaq.

**QAVRANILMAZ** *sif.* Qavranıla bilməyən, dərk edilə bilməyən.

**QAVRANILMAZLIQ** *is.* Qavranılmaz şeyin halı, keyfiyyəti, xassəsi; dərkedilməzlik.

**QAVRAYIŞ** *is.* Həqiqi varlığın insan tərəfindən bilavasitə hissən qavranılması; xarici aləmin hadisələrini qavramaq, dərk etmək, fərqləndirmək və anlamaq qabiliyyəti; qavramaq işi, qavramaq qabiliyyəti. *Əgər duyğu və qavrayış kifayət qədər qüvvətli olsa, o halda cismin surətini, həmin cisim qarşımızda olmadıqda belə, təsəvvürlər şəklində uzun müddət hifz edə bilərik.* Hacıyev.

**QAVRAYIŞLI** *sif.* Qavramaya qabil olan; asan qavranıla bilən; əhatəli, geniş.

**QAYA** *is.* 1. Daşlıq və sarp dağ; daşlıq uçurum, yarğan. [Aydəmir:] *Allah özü bilir ki, o keçilməz meşələrdə, o çıxılmaz qayalarda Aydəmir bircə sənin xəyalınla yaşayır.* C.Cabbarlı. *Bir gün dağın başında oturub dəhşətli qayalarımıza və onların arasından şaqqıltı ilə axan çaylığa tamaşa edirdim.* S.S.Axundov. *Kimdir qartal kimi qayada yatan; Pəncəsi düşmənin gözünə batan?* S.Vurğun.

2. Çox iri və sərt daş. *Dəniz kənarında iri qayalar vardır. Qayıq qayaya toxunub parçalandı.*

**QAYABAŞI** *is. məh.* Çobanların qaya başında oxuduqları bir mahnı adı.

**QAYACIQ** *is.* Kiçik qaya.

**QAYAQAPAN** *is. məh.* Kərtənkələ.

**QAYALIQ** *is.* Qaya olan yer, qaya. *Çıxalım Buzovnada kiçik qayalıqlara; Seyr edəlim bir ara.* M.Müşfiq. *Bir az kənarda qayalıqlar gözə dəyir.* M.İbrahimov. *Gün çıxanda Rüstəm qayalıq və meşəliyin arası ilə irəliləyir, zümzümə edirdi.* S.Rəhimov.

**QAYAYARPAĞI** *is. məh. bot.* Xörəyə işlənən iri, yaşıl yarpağı olan qaya bitkisi.

**QAYÇI** *is.* 1. Ortadan qadaqla bir-birinə çarpaz bənd edilmiş iki hissədən ibarət kəsici alət. *Dərzi qayçısı. Dəllək qayçısı. Bağban qayçısı.* – *..Tütünçüoğlu ülgüc və qayçını çıxarıb Molla Qurbanın bığlarını və saqqalını qırxdı.* M.S.Ordubadi.

2. *məc. iqtis.* İki şey arasında uyğunsuzluq.

**QAYÇIBATMAZ** *is.* b a x **qayçıkəsməz** 2-ci mənada.

**QAYÇIGÖRMƏMİŞ** *sif. dan.* Kəsilməmiş, işlənməmiş, bütöv halda qalmış.

**QAYÇIKƏSƏN** *is. zool.* Torpaq altında yaşayan, baş tərəfində mişar kimi dişləri olan qayçıya bənzər bir qurd, böcək.

**QAYÇIKƏSMƏZ** *is.* 1. *etnoqr.* Köhnə məişətdə: toy paltarlarını kəsmək əsnasında düşərlik olaraq istənilən qayçı haqqı, parça, xələt və s.

2. Yerliyi bərk, parlaq, şax ipək parça. *..Nə bilim kimin arvadı qayçıkəsməzdən tuman tikib.* N.Vəzirov.

**QAYÇILAMA** "Qayçılamaq"dan *f.is.*

**QAYÇILAMAQ** *f.* Qayçı ilə kəsmək, qayçı ilə üzdən götürmək; qayçı ilə budamaq. *Uşağın saçlarını qayçılamaq. Bağban ağacın quru budaqlarını qayçıladı. Qoyunun yununu qayçılamaq.* – [Xortdan:] *Bunu deyib, öz əli ilə Nəsrəddin şahın bığının qabağını qayçıladı.* Ə.Haqverdiyev. *Yekə bir qayçı alıb papaqları qayçılamağa başladım, çünki ustam qalıntüklü papaqları qayçılayanda görmüşdüm.* H.Sarabski.

**QAYÇILANMA** "Qayçılanmaq"dan *f.is.*

**QAYÇILANMAQ** *məch.* Qayçı ilə kəsilmək, vurulmaq, budanmaq. *Ağacın budaqları qayçılanmalıdır.*

**QAYÇILATMA** "Qayçılatmaq"dan *f.is.*

**QAYÇILATMAQ** *icb.* Qayçı ilə kəsdirmək, vurdurmaq, budatmaq. *Artıq saçı qayçılatmaq. Meynələri qayçılatmaq.*

**QAYDA** *is.* [*ər.*] 1. Nizam, səliqə; bir şeyin düzgün vəziyyəti, nizamda olması. *Qaydaya salmaq. Şeyləri qaydada saxlamaq. Qayda yaratmaq. Otaq tam qaydadadır.*

2. Bir şeyin yerinə yetirilməsi üçün müəyyən üsullar göstərən qərar və s. *Seçki qaydaları. Daxili intizam qaydaları. Elektrik qüvvəsindən istifadə qaydaları. Ali məktəblərə qəbul qaydaları. İmla qaydaları. Küçə hərəkəti qaydaları.*

3. Üsul, yol, tərz. *Məqalə müzakirə qaydası ilə buraxılır. Bundan sonra yeni qayda ilə işləməli.* – [Şahbaz bəy:] *Gələn il bir özgə qayda ilə paltar geyəcəklər.* M.F.Axundzadə. ☐ **Bu qayda ilə** – bu üsul ilə, bu cür. [Məmmədnəsir:] *..Atam öləndə mənə nəsihət edib dedi: "Bala, sən də bacar mənim kimi, dövlətlilərin pullarını çək, ötür içəri". Bu qayda ilə iki ev və dükan sahibi olmuşam.* Ə.Haqverdiyev. **Öz qaydasınca** – öz yolu ilə. *Dünyada hər iş öz qaydasınca gedir.* C.Məmmədquluzadə. *..Yelkəndə oxuyub-çalanlardan başqa heç bir kəs yox idi. Şərab süfrəsi də öz qaydasınca düzəldilmişdi.* M.S.Ordubadi.

4. Adət, dəb. *Xumar-xumar baxmaq göz qaydasıdır; Lalətək qızarmaq üz qaydasıdır.* M.P.Vaqif. // "**Qaydadır**" şəklində – adətdir, xasiyyətdir. *Namərddə qaydadır kəsər basdığın; Hər kəs hesab çəksin öz arasında.* Aşıq Ələsgər.

**QAYDA-QANUN** *is.* Nizam və intizam; üsul, qayda. *Qayda-qanun qoymaq. Qayda-qanunu pozmaq. Qayda-qanun gözləmək.* – [Tahir:] *Mənim fikrimi azdırma, mən cəbhəni demirəm. Oranın öz qayda-qanunu var.* M.Hüseyn. // Əvvəlcədən qəbul edilmiş, ənənə halını almış üsul. *Lakin insanlara dövlət və qayda-qanun lazımdır, dövlət isə rəhbərsiz keçinə bilməz, çünki ədalət və qayda-qanun olmadıqda ruzi yeyən adam ruzi verənin qədir-qiymətini bilməz.* "Qabusnamə".

**QAYDALI** *sif.* Qaydaya, üsula müvafiq; səliqəli, müntəzəm, düzgün, yaxşı düzəldilmiş. *Qaydalı iş. Qaydalı otaq. Qaydalı hərəkət. Qaydalı* (z.) *otur. – Ağcaxanım da oynamağa başladı. Bunun oynamağı gözəl və qaydalı* (z.) *idi.* S.S.Axundov. [Knyaz:] *Süleyman bəy, burada mənə qonaqsınız. Mən sizə qaydalı gürcü naharı verəcəyəm.* Ə.Haqverdiyev.

**QAYDAMAQ** [*pol.,* əsli *türk.*] *tar*. 1. XVII-XVIII əsrlərdə polyak mülkədarları əleyhinə üsyanda iştirak etmiş ukraynalı kazak.

2. 1918-ci ildə Ukraynada vətəndaş müharibəsi dövründə: müxtəlif əksinqilabçı dəstələrin əsgəri.

**QAYDASIZ** *sif.* Nizamsız, səliqəsiz, tərtibsiz, pozğun, düzgün olmayan. *Qaydasız iş. Qaydasız hərəkət. Qaydasız yeriş. – Təcrübədən bilirik ki, məhsulun qaydasız* (z.) *yığılması .. böyük zərər vurur.* Ə.Vəliyev.

**QAYDASIZLIQ** *is.* Qayda və nizam olmaması, səliqəsizlik, nizamsızlıq, pozğunluq.

**QAYƏ** *is.* [*ər.*] Yüksək məqsəd; bir işin, təşəbbüsün son məqsədi. [Məhərrəm] *çalışmaq, çarpışmağın zövqünü dadmış, yaşadığı dövr və mühitin qayəsini az-çox anlamışdı.* A.Şaiq. *İnsanlara bəxtiyarlıq, ağgün, səadət! Qayəmiz budur ancaq.* O.Sarıvəlli. // Ümumiyyətlə, məqsəd, məram. *Niyə qıydın sən o solğun mələkə? Bu vurub-yıxmağının qayəsi nə?* Ə.Cavad.

**QAYƏSİZ** *sif.* Heç bir qayəsi olmayan, qarşısına heç bir yüksək məqsəd qoymayan; məqsədsiz. *Qayəsiz, məqsədsiz keçən bir insan ömrü ona* [Kərimxana] *bir heyvan həyatından fərqli görünmürdü*. M.İbrahimov.

**QAYƏSİZLİK** *is.* Heç bir qayəsi, məqsədi olmama; məqsədsizlik. *Əmirxanı qayəsizlik yerdən qopardı; Aqronomluq sənətinə getmədi daha*. S.Vurğun.

**QAYƏT** *zərf* [*ər.*] *köhn*. Çox, son dərəcə, nəhayət dərəcədə, olduqca. *Qayət şərm ilə və ahəstə səs ilə ərz etdilər*. M.F.Axundzadə. *Əvvəl zaman kürreyi-ərzin qabığı qayət nazik olub.* H.Zərdabi. *Doğrudan da Aslan qayət qəyur, çalışqan bir uşaq idi.* C.Cabbarlı. *Tükəzban qayət hirsli olaraq içəri daxil oldu. Nədənsə ovqatı çox təlx idi.* B.Talıblı.

**QAYĞANAQ** *is.* Çalınıb və ya bütöv halda yağda bişirilmiş yumurtadan ibarət yemək. *Məşədi İmaməli naharı hazırladı və çox səliqəli və çox ləzzətli plova və bal qayğanağına bizi qonaq elədi.* C.Məmmədquluzadə.

**QAYĞI** *is.* 1. Birinin rifahı üçün göstərilən diqqət, ya fəaliyyət; birinin fikrini çəkmə, dərdinə qalma, qeydinə qalma. *Bilmədim o günün ani nəşəsi; Mənə dərd olacaq ömrüm uzunu; Bəlkə ev qayğısı, övlad nəfəsi; Olmasa indi də duymazdım bunu.* M.Araz. // Fikir, əndişə, təlaş. *Hər gün onun* [Firidunun] *vaxtı min bir qayğı içərisində keçirdi*. M.İbrahimov. ☐ **Qayğı göstərmək (çəkmək)** – 1) birinin rifahı üçün çalışmaq, fikrini çəkmək, qeydinə qalmaq. [Hacı Nəsir:] *..Mən sənin kimi bir kasıb qızını dilənçilikdən qurtarıb özümə arvad etdim ki, sən də o yaxşılığın əvəzində bu uşağa analıq edib qayğısını çəkəsən, yoxsa onun üçün cəllad olasan?* S.S.Axundov; 2) dərd çəkmək, fikir çəkmək. *Düşmüşəm dərdinə, çox möhnətü qayğu çəkirəm; Deyə bilməm sənə, amma elə gizli çəkirəm.* M.P.Vaqif. **Qayğısına qalmaq** – b a x **qayğı göstərmək** 1-ci mənada. *Nəsib dayı onun* [Zeynəbin] *hər dərdini bilmək, qayğısına qalmaq istəyirdi*. İ.Şıxlı. // Baxma, qulluq etmə, xidmət etmə. *Qayğı olsa bitkilər yaxşı bitər.* // *məc.* Şəfqət, nəvaziş. *Əminə bir bacı qayğısı ilə Əjdərin başındakı sarğıları düzəltdi*. S.Rəhimov.

2. Dərd, möhnət, fikir, qəm. *Onun heç bir qayğısı yoxdur. – Hayıf, ömür qısa, arzu genişdir; Kim bu qayğı ilə titrəməmişdir*. M.Müşfiq.

**QAYĞIBİLMƏZ** *sif.* Dərdi, kədəri, qayğısı olmayan; xoşbəxt, məsud. *Sən bu sərbəst göylərin, sərbəstcə yıldızısan; Qayğısız bir ölkənin, qayğıbilməz qızısan!* Ə.Cavad.

**QAYĞICIL** *sif.* Çox qayğıya qalan, çox qayğıkeş.

**QAYĞICILLIQ** *is.* Qayğıkeşlik, qeydkeşlik.

**QAYĞIKEŞ** *sif.* Qayğı çəkən, qayğı göstərən, qayğıya qalan. *Əli dayandı, sifətinə qayğıkeş bir görkəm verdi.* İ.Şıxlı. *Fədakar, qayğıkeş bağbanı varsa; Bir gülü solsa da, min gül bitirər.* Şəhriyar.

**QAYĞIKEŞLİK** *is.* Qayğı çəkmə, qeydə qalma, qeydkeşlik. *Qonaq sərxoş olduqdan sonra getmək istəsə, bir-iki dəfə qalmasını xahiş et, qayğıkeşlik göstər, qoyma getsin, üçüncü dəfə icazə ver getsin.* "Qabusnamə".

**QAYĞILI** *sif.* 1. Qayğısı olan, qayğı çəkən. *Qayğılı ana. – Qayğılıya söhbət haramdır.* (Ata. sözü). // Qayğıkeş. *Sevən həm qayğılı, həm də qayğısız; Sevin – səninkidir bu boyda aləm.* M.Araz.

2. Qəmli, kədərli, qüssəli, fikirli. *Səfasız sufi daim qayğuludur.* Nəsimi. *Saqiya, cam tut ol aşiqə, kim qayğuludur; Qayğu çəkmək nə üçün, cam ilə aləm doludur.* Füzuli. *Qəmlidir günlərimiz, qayğuludur; Dərd ilə həp dirliyimiz doludur.* A.Səhhət.

**QAYĞISIZ** *sif.* 1. Fikri, qayğısı olmayan, heç bir şeyin fikrini, qeydini çəkməyən; fikirsiz, laqeyd. [Kərim xan] *Tehranın boşalmış küçələrinə tamaşa edir, qayğısız bir adam kimi yavaş-yavaş yeriyirdi.* M.İbrahimov.

2. Qəmsiz, kədərsiz, dərdsiz. *Qayğısız adam heç kəsin dərdini çəkməz. – Bu qayğısız* (z.) *yaşamağı, əlqərəz; Bir şey ilə etmək olarmı əvəz?* A.Səhhət. [Bəypolad:] *Qayğısız bir həyatı, əcəba, hansı qız istəməz?* H.Cavid. *Qüdrət bu sözləri də adəti üzrə qayğısız bir təbəssümlə qarşıladı.* M.Hüseyn.

3. Himayəsiz, kimsəsiz, baxımsız. *Övlad özü də qayğısız qaldığını güman etməməlidir.* S.Rəhimov.

**QAYĞISIZCA** *zərf* Qayğısız, fikirsiz; laqeyd surətdə. *Qayğısızca ətrafa göz gəzdirmək.*

**QAYĞISIZLIQ** *is.* Həyatda hər şeyə qayğısız münasibət; laqeydlik, qeydsizlik. *Bütün o qayğısızlıq pərdəsi altında sevən qız qəlbi nə qədər böyük və fədakar bir məhəbbət əzizləyib bəsləmişdir.* Ə.Məmmədxanlı.

**QAYIDAN** *f.sif. xüs.* Geri dönən, inikas edən. *Qayıdan tənlik* (riyaz.). *Qayıdan şüa. – Nədir günahınız, açıq danışın; Üstümə qayıdan yazılarım, siz! Hansı bir naşının, bir ağlı çaşın; Ələk baxışından keçməmisiniz?!* M.Araz.

**QAYIDIŞ** *f.is.* Qayıtmaq işi. [Konduktor:] *Müharibə vaxtı Bakıya gəlməmişsiniz?* [Nəriman:] *İlk qayıdışımdır.* Mir Cəlal. *Gördülər qayıdıb Qafur döyüşdən; ..Gördülər yollar da çən-duman deyil; Bu toylu-düyünlü qayıdış üçün; Yollar pərişan deyil.* N.Kəsəmənli.

◊ **Qayıdış növ** *qram.* – işin iş görən üzərində icra olunduğunu bildirən feil növü. *Duman çəkildi.*

**QAYIQ** *is.* 1. Su nəqliyyat vasitəsi. *Motorlu qayıq. Yelkənli qayıq. Balıqçı qayığı. Qayıqda gəzmək. – Qayıqlar, gəmilər üzür yanaşı; Sallanan bayraqlar əks edir suya.* S.Vurğun. *Tapdıq paltarlarını kiçik qayıqda qoyub suya girdi.* Ə.Əbülhəsən.

2. Hərb gəmilərinin bəzi növlərinin adı. *Sualtı qayıq. Keşik qayığı.*

**QAYIQÇI** *is.* Qayıq işlədən, qayıqda kürək çəkərək qayığı sürən adam. *Qayıqçı bizi çayın o tayına keçirdi. – ..Bizə öz adamımız olan yaxşı qayıqçı lazımdır.* A.Şaiq. *Qayıqçını səslədi: – Tez motoru işə sal.* M.Seyidzadə.

**QAYIQÇILIQ** *is.* Qayıq sürmək peşəsi, qayıqçı sənəti.

**QAYIM** *sif. köhn.* 1. Uca, bərk, zil. *Molla İbrahim Xəlil bu halət ilə görməkdən vəch edib, qayım sövt ilə çığırırdı.* M.F.Axundzadə.

2. Bərk, möhkəm, ağır, tutarlı. *Təzəcə dəyənək alıbsan ələ; Qayım tut ki, nagah düşər, ağlarsan.* M.V.Vidadi. [Vəzir:] *Əlbəttə, sabah ona bundan qayım sözlər deyəcəyəm.* M.F.Axundzadə. *Odabaşı əlini ölçə-ölçə qayım səs ilə başladı: – A kişi, sən allah, zarafat eləmə..* C.Məmmədquluzadə.

3. Simic, xəsis, bərk. [Zalxa:] *Niyə qayım olmayım, səndən mən nə xeyir görmüşəm?* M.F.Axundzadə.

**qayım-qayım** *zərf məh.* Bərk-bərk, möhkəm. *Mənim kimi bir sirdaşın yanında; Qayım-qayım sarınmağın nədəndir?* M.P.Vaqif.

**QAYIN**[1] *is.* Ər və ya arvadın qardaşı. *Hümmət, Tağı əminin xalası oğlu və həm də qaynı idi.* S.S.Axundov. [Yaxşı:] *Qaynım dünən araba ilə şəhərə gedib.* C.Cabbarlı.

**QAYIN**[2], **QAYINAĞACI** *is.* bax **ağcaqayın**.

**QAYIN**[3] *is.* [*ər.* ğayın] Ərəb əlifbasında "غ" işarəsi ilə yazılan hərfin adı.

**QAYINANA** *is.* Ər və ya arvadın anası. *Sona xala gözəl bir gəlin qayınanası oldu.* S.S.Axundov. *Qayınanalarınıza çox da üz verməyin, evinizə pərxaşlıq salar*. Qantəmir. *Qayınanasının ona ürək-dirək verməsinə baxmayaraq, Durna qərarsız oldu.* İ.Əfəndiyev.

**QAYINARVADI** *is.* Qayının arvadı.

**QAYINATA** *is.* Ər və ya arvadın atası. *Haman axşam ki, Vəliqulu anası ilə sözə gəldi, çıxıb üz qoydu düz qayınatası Xudayar bəygilə*. C.Məmmədquluzadə. *Bir tərəfdən əri, o biri tərəfdən də qayınatası bütün acıqlarını Gülyazdan çıxmağa başladılar*. M.Hüseyn.

**QAYINXATINI** *is.* Qayınarvadı. *Bu darvazanın ixtiyarı Əminənin böyük dul qayınxatınısı Dürdanə xanımda idi.* Ə.Əbülhəsən.

**QAYIRMA** 1. "Qayırmaq"dan *f.is.*

2. *sif.* Saxta, uydurma, qondarma. *..Sədr və katibin imzaları da qayırma və uydurma imzalardır*. M.S.Ordubadi. // Süni. *Qayırma diş*. – *..Balaca bir binada bomba hazırlandığını göstərən alət və hissələr və bir qayırma saqqal tapdılar.* P.Makulu.

**...qayırma**. Bəzi isimlərə qoşularaq, ismin ifadə etdiyi şeyin istehsalı ilə əlaqədar olan mürəkkəb sözlər düzəldilir; məs.: maşınqayırma, dəzgahqayırma və s.

**QAYIRMAQ** *f.* 1. Emal etmək, hazırlamaq, istehsal etmək. *Bu fabrikdə mebel qayırırlar. Süddən pendir qayırırlar. Usta güzgü qayırır.* – *Şərh edir gah süd qayırmağı; Ki qatıqdan belə çəkin yağı.* S.Ə.Şirvani.

2. Bina etmək, qurmaq, tikmək. [Məhəmmədəli:] *Elə artıq hesab deyil, ağa... Təndirxana uçmuşdu, onu qayırmışam*. N.Vəzirov. // Düzəltmək, təşkil etmək. [Məstan bəyin] *özünə hər tərəfdən təzyiq etdilər və axırda da evini alıb, klub qayırdılar*. B.Talıblı.

3. Hazırlamaq, düzəltmək, qurmaq. [Bayram:] *Çox yaxşı, əgər mən bir hiylə qayıram ki, Tarverdi aradan çıxa, sən azad qalasan, ona razısanmı?* M.F.Axundzadə. [Şahnisə:] *Ay uşaq, cəld bir ocaq qayırın, qəhvə içək, – dedi.* Çəmənzəminli.

4. Təmir etmək, əyər-əskiyini, çatışmayan yerlərini düzəltmək. *Damın axan yerini qayırmaq*.

5. İş görmək, bir işlə məşğul olmaq. *Orada nə qayırırsan? Bu vaxta qədər evdə nə qayırırdın?* // Etmək, bacarmaq, əlindən gəlmək. *Camaatın qabağında Fərhad bəy nə qayıra bilər?* Qantəmir. *Bu ayıqlığın qabağında* [Cuma] *nə qayıra bilərdi?* Ə.Əbülhəsən.

**QAYIRTDIRMA** "Qayırtdırmaq"dan *f.is.*

**QAYIRTDIRMAQ** *icb*. Başqasına qayırtmaq, düzəltdirmək, yaxud təmir etdirmək. *Evin damını qayırtdırmaq. Ayaqqabını qayırtdırmağa vermək.*

**QAYIRTMAQ** "Qayırmaq"dan *icb*.

**QAYIŞ** *is.* 1. Belə bağlamaq, yaxud bir şeyi sarıyıb bağlamaq üçün zolaq şəklində kəsilmiş dar uzun dəri və s.; kəmər. *Çamadan qayışı. Yəhər qayışı. Məfrəş qayışları. Çanta qayışı.* – *Əksərən .. cibli köynək geyərək, belini qayışla bərkitmiş kişilər arabanın yan tərəfinə dolmuş*(*du*). M.İbrahimov. *Allahyar kəhərin qoltuqaltısını yoxladı, qarın qayışını çəkib bərkitdi.* İ.Şıxlı. // Ülgüc itiləmək üçün ensiz uzun dəri.

2. *tex*. Hərəkəti bir təkərdən o birinə nəql etmək üçün baş-başa tikilmiş uzun dəri, möhkəm brezent və s. zolağı. *İntiqal qayışı.* – *Döyünən, çırpınan qayışlı çarxlar; Sapsarı su axan xırdaca arxlar..* S.Vurğun.

◊ **Qayış kimi** – 1) çox bərk, çox sərt; 2) qoparılmaz, qopmaz.

**QAYIŞBALDIR** *sif.* və *is. dan.* 1. Arıq, qıçları nazik, lakin çox qüvvətli və yapışdığı şeydən ayırmaq mümkün olmayan (adam). *Qayışbaldır adam*.

2. Əfsanələrdə: insan və ya heyvana yapışdıqda ondan ayrılmayan mövhum bir vücud. *Axırda qayışbaldırlar şallaq çəkib onları öldürdülər.* (Nağıl).

**QAYIŞQIRAN** *is. məh. bot*. Çox möhkəm və qırılmaz kökləri olan bir ot.

**QAYIŞQURD** *is. zool.* Balıqların bədən boşluğunda parazitlik edən lentşəkilli qurd.

**QAYITMA** "Qayıtmaq"dan *f.is.*

**QAYITMAQ** *f.* 1. Getdiyi yoldan və ya yerdən geriyə, əvvəlki yerinə dönmək. *O getdiyi yerdən qayıtdı. Səfərdən qayıtmaq. Geri qayıtmaq.* – [Almaz:] *Yoldaşlar, mən özüm bu kənddənəm. Getmişəm, oxumuşam, yenə də qayıdıb bu kəndə, sizin aranıza gəlmişəm*. C.Cabbarlı. [Xudayar bəy:] *Qərəz, keçib, indi hava qaranlıqlayır, mən dəxi kəndə qayıda bilmərəm.* C.Məmmədquluzadə. *Gülnaz*

*kabab gətirdi, süfrəyə qoyub qayıtmaq istədi.* M.İbrahimov. ☐ **Qayıdan baş** – qayıdanda, geri dönəndə. [Namaz:] *Ağa, pristav səhər buradan Xocabəhmənliyə adlayıb və deyibdir ki, qayıdan baş Cahangir ağa ilə görüşəcəyəm.* Ə.Haqverdiyev.

2. Dönmək, yenidən gəlmək, yenidən başlamaq, yenidən müraciət etmək. *Köhnə işinə qayıtmaq. Əvvəlki fikrinə qayıtmaq. Bu mövzuya sonra yenə qayıdacağıq.*

3. Yenidən meydana gəlmək, zahir olmaq, təzələnmək, bərpa olmaq. *Qüvvəm özümə qayıtdı. Xəstəliyi qayıtdı.*

4. "**Qayıdıb**" şəklində – 1) dönüb, dönərək, üzünü çevirərək; 2) cavab olaraq. *Qayıdıb dedim. – Qanunu əyəndə; onun ziyanı; Qayıdıb özünə dəyəcək yenə...* B.Vahabzadə. *Salatın qayıdıb dəyəyə girdi.* İ.Şıxlı.

**QAYITMAZ** *sif.* 1. Dönməz, möhkəm. *Seyrəltməyə xiyabanda; Qayıtmaz əllər yaraşır; Alanın kökün kəsməyə; Toxalar, bellər yaraşır.* Aşıq Əli.

2. Qayıtmaq mümkün olmayan, gedərgəlməz; xətərli, təhlükəli. *Qızım, mən qayıtmaz bir evə gedirəm, səni babana kim aparsın?* S.S.Axundov.

**QÁYKA** *is.* [*rus.*] *tex.* Boltları bərkitmək üçün onların başına keçirilən çoxüzlü yivli halqa.

**QAYMA** *is.* Böyük daş parçası. *Qayadan qopmuş bir qaymanı işçilər yolun ağzından bir tərəfə çəkdilər.*

**QAYMAQ** *is.* 1. Bişirilən, ya sərilən südün, yaxud qatığın üzünə yığılan qatılaşmış yağ maddəsi. *Camış* (*qoyun inək*) *qaymağı. – Suvarmasam yanar otlar, çiçəklər; Ac qalanda süd verməsə inəklər; Nədən olar şor, pendir, yağ, qaymaqlar?* A.Səhhət. ☐ **Qaymaq bağlamaq** – b a x **qaymaqlanmaq**. **Qaymaq kimi** *məc.* – 1) çox ləzzətli, dadlı; 2) son dərəcə ağ və yumşaq şey haqqında. **Qaymaq yağı** – qaymaqdan alınan yağ, ən əla kərə yağı. *Avropa şəhərlərinin ətrafında yağ çalxalayanlar kərə yağı bir neçə qisim edib, onun əlasını yemək üçün satırlar və belə əla yağa qaymaq yağı deyirlər.* "Əkinçi".

2. *məc.* Hər şeyin ən yaxşı, ən seçilmiş hissəsi. *Cəmiyyətin qaymağı.*

3. *məc.* Ləzzət mənasında. [Musa:] *Çəkil gözlərimin səkisindən, mən təzə eşqin qaymağını yeməyə gedirəm.* S.Rəhman.

**QAYMAQÇİÇƏKLİLƏR** *cəm* b a x **qaymaqçiçəyi**.

**QAYMAQÇİÇƏYİ** *is. bot.* Çəmənlərdə, meşələrdə bitən zəhərli sarı ot. ☐ **Qaymaqçiçəyi fəsiləsi** *bot.* – bir çox zəhərli növləri olan çoxillik, ya birillik otlar.

**QAYMAQLANMA** "Qaymaqlanmaq"dan *f.is.*

**QAYMAQLANMAQ**[1] *f.* Qaymaq tutmaq, qaymaq bağlamaq, üz tutmaq. *Südün üzü qaymaqlandı.*

**QAYNADILMA** "Qaynadılmaq"dan *f.is.*

**QAYNADILMAQ** "Qaynatmaq"dan *məch. Axşama yaxın bütün evlərdə süfrələr salınar, samovar qaynadılardı.* H.Sarabski.

**QAYNADILMIŞ** b a x **qaynanmış**.

**QAYNAQ**[1] *is.* Bir şeyin qaynayıb çıxdığı yer; mənbə. *Bu dərə başdan-başa su qaynağı idi.* A.Şaiq. "*Mərcan suyu*" *qaynağın; Ellər sənin oynağın; Nə gözəldir yanağın; Gəlin kimi baxan Kür!* Ə.Cavad. *Qaynaqdan bulandıran elə bulandırdı ki; Suyumuz durulmadı.* B.Vahabzadə. // Yerdən qaynayıb çıxan bulaq, çeşmə və s. *Ağbulaq kəndinin aşağı səmtində, yaşıl meşəliyin içində qaynayan Turşsu qaynağı hamının diqqətini cəlb etməyə başladı.* S.Rəhimov. *Almalı, armudlu bu bağlar sənin; Səadət qaynaqlı bulaqlar sənin.* Şəhriyar. // *məc.* Mənbə, mənşə mənasında. *Sən öylə ziya qaynağısan, ey gözəl afət; Yandıqca o hüsnün şamı, pərvanə gülümsər.* A.Şaiq.

**QAYNAQ**[2] *is. tex.* 1. Metalda qaynayıb (qaynaq olub) bitişən yer.

2. Metal hissələrin aralarına ərgin metal tökmək yolu ilə onları birləşdirmə, bitişdirmə üsulu. *Borunun hissələri bir-birinə qaynaq edildikdə məlum oldu ki, bunların bəziləri yolda zədələnmişdir. – Qoruyucu borular adətən 6-10 m uzunluğunda olub, bir-biri ilə qaynaq vasitəsilə birləşdirilir.* Quliyev.

**QAYNAQ**[3] *is.* 1. Alıcı və yırtıcı quş çəngəli, caynaq. *O necə quş idi, qayada səkər; Qaynağı neştərdir, qanımı tökər.* Xəstə Qasım.

2. *məc.* Əl, pəncə, çəng, caynaq. *Mən onu elə əlimə dolayaram ki, ömrü olanı qaynağımdan qurtara bilməz.* Ə.Haqverdiyev.

**QAYNAQÇI** *is. xüs.* Qaynaq işilə məşğul olan fəhlə (b a x **qaynaq²**). *Buruqda kəmər endirilərkən, boruları eyni zamanda iki qaynaqçı qaynaqlayır.* Quliyev.

**QAYNAQÇILIQ** *is.* Qaynaqçının işi, ixtisası.

**QAYNAQLAMA** "Qaynaqlamaq"dan *f.is.*

**QAYNAQLAMAQ¹** *f. tex.* Qaynaq etmək, qaynaq edib bitişdirmək, qaynaq vermək (b a x **qaynaq²**). *Boruları qaynaqlamaq.* – [Yusif:] *Karkasları quraşdırdıq, bir neçə saata bütün mərtəbə hazır oldu. Bu saat elektriklə qaynaqlayırlar.* S.Rəhman.

**QAYNAQLAMAQ²** *f.* Qaynağına keçirmək, pəncəsinə keçirmək.

**QAYNAQLANDIRILMAQ** *məch. tex.* Qaynaq edilmək, qaynaq edilib bitişdirilmək. *1923-cü ildə ilk dəfə olaraq qazıma baltaları sərt xəlitələrlə qaynaqlandırılmağa başlandı.* Quliyev.

**QAYNAQLANMA¹** "Qaynaqlanmaq¹"dan *f.is.*

**QAYNAQLANMA²** "Qaynaqlanmaq²"dan *f.is.*

**QAYNAQLANMAQ¹** *f. tex.* Qaynaq tutmaq, qaynaq olub birləşmək, bitişmək (b a x **qaynaq²**).

**QAYNAQLANMAQ²** *f.* Qaynağa keçirilmək, pəncəyə keçirilmək (b a x **qaynaq³**).

**QAYNAQLI** *sif. xüs.* Qaynağı olan, qaynaqla bitişdirilmiş.

**QAYNAMA** 1. "Qaynamaq"dan *f.is. Suyun qaynama dərəcəsi.*

2. *is.* Bulaq, çeşmə. *O ağaclar, o dadlı qaynama da; Gündən az qaldı qovrulub solsun.* A.Səhhət.

◊ **Qaynama nöqtəsi** *fiz.* – bir cismin bir haldan başqa hala (məsələn, suyun qaynayaraq buxar halına) keçməsi üçün lazım olan hərarət həddi.

**QAYNAMAQ** *f.* 1. Bərk qızdırılmaq, ya qızmaq nəticəsində buxarlanaraq pıqqıldamaq, paqqıldamaq, qələyan etmək, köpüklənmək (mayelər haqqında). *Su qaynayır. Müxtəlif mayelər müxtəlif temperaturda qaynayır.* // İçində maye, xörək qaynayan qab haqqında. *Qazan qaynayır. Çaydan qaynayır. – Samovar elə şiddətlə qaynayır ki, guya bu saat hərəkət edəcək.* C.Məmmədquluzadə.

2. Şişib qabarmaq, turşuyub qabarmaq, qıcqırmaq. *Üzüm şirəsi qaynamağa başladı.*

3. *məc.* Yerdən şiddətlə çıxıb qabarmaq, fışqırmaq, köpüklənmək, axmaq. *Çeşmə yerdən qaynayıb axır. – Buradan mən görürəm çeşmələri qaynamada.* A.Səhhət. *Ey oğlum, özün də bu qabaq tərəfdə, qaynayan bulaqdan sərin su içərsən.* S.Rəhimov.

4. *məc.* İntizamsız bir surətdə hərəkət edən saysız-hesabsız adam və ya heyvan, həşərat və s. kütləsi haqqında. *Küçələr adamla qaynayır. – Yenə mən keçirəm küçələrindən; Yenə qaynayırsan, qocaman şəhər.* S.Vurğun.

5. *məc.* Bir şeyin çox güclü, şiddətli, coşqun təzahürünü ifadə edir. *Onun solğun yanaqlarında qəribə bir qızartı, gözlərində isə kəskin parıltı qaynayırdı.* Ə.Əbülhəsən. *Qoca əxinin sinəsi isə sanki tükənməz bir bulaqdı, o daima qaynayır..* Ə.Məmmədxanlı.

6. *məc.* Daim hərəkətdə olmaq, bir an rahat olmamaq. *Bu adamın bir dəqiqə rahatlığı yoxdur, daim qaynayır.* // *məc.* Dalğalanmaq, coşmaq, köpüklənmək, qabarmaq. *Dəniz qaynayır.*

◊ **Qaynayıb-qarışmaq (qovuşmaq)** – isinişmək, üns tutmaq, yaxınlaşmaq, dostlaşmaq. *O, adamla qaynayıb-qarışan deyil. – Mən bütün qanım və ruhumla qaynayıb sizə qarışmışam.* M.S.Ordubadi. [Qəhrəman] *nə qədər qayğı çəksə, texnikumun işi ilə qaynayıb-qovuşsa, yenə balaca Sabiri unuda bilmirdi.* S.Rəhimov.

**QAYNANMIŞ** *sif.* Qaynama dərəcəsinə çatdırılmış, qaynama dərəcəsinə çatana qədər qızdırılmış. // Qaynar suda bişirilmiş. *Qaynanmış ət.* – [Gülli xanım:] *Bax, bu qaynanmış sudu. Qablarınızı doldurun. Əyər başqa boş qabınız varsa, tez gətirin gəlin, sizi gözləyirəm.* İ.Şıxlı.

**QAYNAR** *sif.* 1. Qaynama halında olan; yandırıcı, çox yüksək hərarətli; dağ, büryan. *Qaynar su. Qaynar çay. Çiy tərəvəzi və meyvəni xörəyə salmadan əvvəl, yaxşı yumaq və üstünə qaynar su tökmək lazımdır. – Sabun zavodunda işləyən* [Kərim xan Azadinin] *atası qaynar sabun qazanına düşüb həlak olduğu zaman onun altı yaşı vardı.* M.İbrahimov. *Bu zaman qız qaynar samovarı gətirib süfrəyə qoyub, çay dəmləyib, ləb-ləb stəkanlara çay tökərək qonaqların qabağına qoyur.*

H.Sarabski. // Çox isti, hərarətli, qızğın, qızmar. *Əsən yellər, ətir saçır bizim qaynar çöllərə*. S.Vurğun. *Yay günəşi o gün qaynar bir ocağı andırırdı*. M.Dilbazi.

2. *məc.* Odlu-alovlu, canlı, ehtiraslı. *Balaca Sabir bir an fikrə gedir, sonra dönüb qaynar gözləri ilə atasına baxırdı*. S.Rəhimov.

3. *məc.* Coşqun, qızğın. *Sənət nədir? O, həyatın qaynar axan çeşməsidir*. S.Vurğun. *Eldən elə, ölkədən ölkəyə gəzdi adı; Dolu, qaynar bir həyat yaşadı*. R.Rza.

4. Qaynayan, fışqıran, qaynayıb çıxan. *Lakin bəzən çıxar, hündür, qarlı dağ; Altından da çox isti qaynar bulaq*. A.Səhhət. *Yenə də yamyaşıl geyinir dağlar; Göz kimi durulur qaynar bulaqlar*. S.Vurğun.

**qaynar-qaynar** *zərf* Qaynar halda, çox isti halda. *Çayı qaynar-qaynar içmək.*

**QAYNARLIQ** *is.* 1. Qaynar şeyin halı (b a x **qaynar** 1-ci mənada).

2. *məc.* Qızğın fəaliyyət, işdə sürət, aktivlik, coşqunluq. *Həmin bu qaynarlıq Şehlidə dərzlərin çoxluğundan deyil, payızın nəmişliyindən, qışın tez gələcəyi qorxusundan idi.* S.Rəhimov.

**QAYNAŞMA** "Qaynaşmaq"dan *f.is.* *Qəsəbə yeni bir qaynaşma və şənlik hiss edirdi. – Birdən camaat içinə qaynaşma düşdü*. Mir Cəlal.

**QAYNAŞMAQ** *f.* 1. B a x **qaynamaq** 4-cü mənada. *Kişilər, övrətlər, uşaqlar .. qarışqa kimi qaynaşırlar.* C.Məmmədquluzadə. *Adamlar stansiyada qaynaşırdılar.* A.Şaiq. [Piri baba və qızlar] *bir başqa pətəyə çatdıqda gördülər ki, buranın arıları pətəyin ağzında qarışqa kimi qaynaşırlar.* S.S.Axundov.

2. Hərəkət etmək, tərpəşmək, bir-birinə qarışmaq. *Dağların başında bulud qaynaşmağına baxmayaraq, hava isti idi*. Çəmənzəminli. *Doğrudan da yuxarıda qəribə bir mənzərə var idi; dağların zirvəsində buludlar qaynaşır.* M.Hüseyn.

3. B a x **qaynamaq** 6-cı mənada.

**QAYNATDIRMA** "Qaynatdırmaq"dan *f.is.*

**QAYNATDIRMAQ** *icb.* Qaynatma işi gördürmək.

**QAYNATMA** 1. "Qaynatmaq"dan *f.is.*

2. *sif.* Qaynadılmış, qaynadılaraq bişirilmiş. Qaynatma hədik.

**QAYNATMAQ** *f.* 1. Bir mayeni od üstündə qaynama dərəcəsinə çatdırmaq, qaynama dərəcəsinə çatıncaya qədər qızdırmaq. *Südü qaynatmaq. Suyu zərərsizləşdirməkdən ötrü ən sadə və ən əlverişli üsul onu qaynatmaqdır.* // İçərisində maye qaynadılan qab haqqında. *Samovarı qaynat. Çayniki qaynadıb daşdırmaq. – Yetər samovarı qaynadıb gətirdi.* Qantəmir. *Uşaq, otağı təmizləməkdə və cihazları qaynadıb yerinə qoymaqda olan anasının ətəyindən tutub dartır..* M.İbrahimov.

2. Bir şeyi qaynar suyun içində bişirmək, yaxud qaynar suyun içində saxlamaq. *Boymadərəni qaynadıb suyunu şüşəyə tökdülər. Paltarları yumaqdan əvvəl qaynatmaq.* // *xüs.* Metaldan düzəldilmiş cərrahlıq və başqa tibb alətlərini işlətmədən qabaq od üstündə qaynar suyun içərisində saxlayıb mikrobsuzlaşdırmaq.

3. *xüs.* Metal parçalarını qızardaraq bir-birinə yapışdırmaq, calamaq, bitişdirmək. *Baltanın küpünü dəmirçi kürədə qaynadıb ağzı ilə bitişdirdi.*

**QAYRILMA** "Qayrılmaq"dan *f.is.*

**QAYRILMAQ** *məch.* 1. Emal olunmaq, hazırlanmaq, düzəldilmək. *Heykəl tuncdan qayrılmışdır. Qazan misdən qayrılmışdır.*

2. Bina edilmək, təsis edilmək, inşa olunmaq, qurulmaq, tikilmək. *Bu körpü nə zaman qayrılmışdır?*

3. Təmir olunmaq, yamanmaq. *Ayaqqabını qayrılmağa vermək.*

**QAYSAQ** b a x **qasnaq**. *..Qaysağı əzəndə hava və hərarət torpağı isidir, pambıq tez bitməyə başlayır*. Ə.Vəliyev.

**QAYSAQLAMAQ** b a x **qasnaqlamaq**.

**QAYSAQLANMAQ** b a x **qasnaqlanmaq**.

**QAYSAQLANMIŞ** b a x **qasnaqlanmış**. *Payız günəşində parıldayan kotanlar qaysaqlanmış əkin yerinə bataraq, torpağı lay-lay şumlayaraq uzaqlaşdı.* M.Hüseyn.

**QAYSAQLI** b a x **qasnaqlı**. *Bostan təzə, bağ təzə; Maral təzə, dağ təzə; Qaysaqlı yaram üstə; Yar çəkibdi dağ təzə.* (Bayatı).

**QAYSAVA** *is.* Qaysı qurusundan hazırlanan yemək; plovun xuruşlarından biri. *İtin əbləhi qaysavadan pay umar.* (Ata. sözü). *Göyçənin qonağa çoxdu hörməti; Qaysava, qayğanaq verir ləzzəti; Plov, dolma, kabab,*

*əmliyin əti; İnsaf elə, tək motaldan danışma!* Aşıq Ələsgər.

**QAYSAVALIQ** *sif.* Qaysava bişirmək üçün yararlı.

**QAYSI** *is.* Cənubda bitən həmin adlı ağacın sarı, ətli, çəyirdəkli şirin meyvəsi. *Qaysı ağacı. Qaysı mürəbbəsi. Qaysı bağı. – Allahyar beş-on girvənkə düyü, kişmiş, qaysı aldı. İki kəllə qənd götürdü.* İ.Şıxlı.

**QAYTAĞI** *is. mus.* Çox iti surətdə ifa edilən Azərbaycan xalq rəqsi və bu rəqsin havası. *Kəndir üstə oynanan rəqslər qaytağı, təkçalma və sairədir.* H.Sarabski. *..Orkestr "Qaytağı" çaldıqda biz bu qaytağının havasını (melodiyasını) ilk dəfə eşitdiyimizə baxmayaraq, bu musiqinin marş və təsnif deyil, məhz qaytağı olduğunu düzgün surətdə təyin edə bilirik.* Ə.Bədəlbəyli.

◊ **Qaytağı oynamaq** *məc. dan.* – ağrıdan qıvrılmaq, çox əziyyət çəkmək. *Gecə səhərə qədər diş ağrısından qaytağı oynamışam.*

**QAYTAQ** *is.* Bağ, bənd.

◊ **Ağzının qaytağı yoxdur** – danışığını bilməyən, ağzına gələni danışan adam haqqında.

**QAYTAN** *is.* Yumşaq iplikdən, ipəkdən və s.-dən hörülmüş bağ, ip. *Yumru qaytan. Tufli qaytanı. – Ağcaxanım yaradan bir o qədər şikayət etmirdi. Yaradan yuxarı qaytan ilə möhkəm bağlanmış yerdən şikayət edirdi.* S.S.Axundov. *İncə və əlvan ipəkdən güllər və çiçəklər tikilmiş yaşıl donu geydi, qabaqdan ipək qaytanlarla bağladı.* M.S.Ordubadi. *Bu meydanda mən tanıdım bağrı tonqal igidləri; Alnındakı ipək qaytan qırmızı, al igidləri.* X.Rza.

**QAYTANLAMA** "Qaytanlamaq"dan *f.is.*

**QAYTANLAMAQ** *f.* 1. Qaytan keçirmək, qaytanla bərkitmək (bağlamaq). *Ayaqqabıları qaytanlamaq.*

2. Paltarın kənarlarına, ətəyinə və ya tikiş yerlərinə qaytan qoymaq, qaytan ilə çevirmək. *Keçmişdə qadınlar paltarlarını qaytanlardılar.*

**QAYTANLANMA** "Qaytanlanmaq"dan *f.is.*

**QAYTANLANMAQ** *məch.* Qaytan keçirilmək, qaytanla bərkidilmək (bağlanmaq).

**QAYTANLANMIŞ** *f.sif.* Qaytan keçirilmiş, qaytanla bərkidilmiş, bağlanmış. *Qaytanlanmış ayaqqabı. Qaytanlanmış dəftər.*

**QAYTANLI** *sif.* Qaytanı olan, qaytanla bağlanan, qaytanla bağlanmış. *Altun qaytanlı saatların əqrəbləri çox təxirlə sürünürdü.* M.S.Ordubadi. *Şamxal ayağa durub kəmərini daraltdı. Boğazı qaytanlı köynəyinin qırışlarını arxaya tərəf yığdı.* İ.Şıxlı.

**QAYTARICI** *is. xüs.* İşıq, ya istilik şüalarını, elektromaqnit dalğalarını və s.-ni qaytarmaq (əks etdirmək) üçün qurğu, cihaz.

**QAYTARILMA** "Qaytarılmaq"dan *f.is.*

**QAYTARILMAQ** "Qaytarmaq"dan *məch.* *Borc hələ də qaytarılmamışdır. – ..Bu güzəştlərin müqabilində Əmirəlmöminin Qızıl Arslanla bağlanmış əhdnamənin geri qaytarılmasını tələb edir.* M.S.Ordubadi.

**QAYTARILMAZ** *sif.* 1. Qaytarılmayan, qaytarıla bilməyən. *Qaytarılmaz itki. – Düşmənimiz arxalandı; Silahına, öz gücünə; Zora təslim olan torpaq; Qaytarılmaz söz gücünə.* B.Vahabzadə.

2. Geri qaytarılmalı olmayan, həmişəlik verilən. *Qaytarılmaz borc.*

**QAYTARIŞ** *is.* Qaytarma işi, qaytarma, qaytarılma.

**QAYTARMA** *is.* 1. "Qaytarmaq"dan *f.is.*

2. *bot.* Çoxillik çəmən bitkisi.

3. Oyun havalarından birinin adı.

**QAYTARMAQ** *f.* 1. Alınmış, yaxud göndərilmiş bir şeyi geri vermək (göndərmək). *Kitabı oxuyub mənə qaytar. Borcunu qaytarmaq.*

2. Xahişlə və ya başqa bir yol ilə bir yerə qayıtmağa, yaxud geri dönməyə məcbur etmək; geri döndərmək. *Yarı yoldan qaytarmaq. Hələ uzaq getməmişkən qaytar! – Məşuqə fənəri alıb qulluqçunu qaytardı.* S.Rəhimov.

3. Rədd etmək, dəf etmək, başdan sovmaq. *Zərbəni qaytarmaq.* ☐ **Söz, cavab qaytarmaq** – özündən böyüyün dediklərini və ya göstərişlərini qəbul etməyərək, qabacasına rədd etmək. [Nənəm mənə deyərdi:] *Biz səni dərsə qoyuruq, sən fikir vermirsən, mollanı aldadırsan, ona cavab qaytarırsan.* H.Sarabski.

**QAZ**[1] *is. zool.* Ördəyə bənzər, lakin ondan böyük, uzunboğaz, əti yeyilən su quşu. *Qaz əti. Qaz yumurtası. – Yeyərsən qaz ətini, görərsən ləzzətini.* (Ata. sözü). *Əgər məşuqə mənzurundu, get bir şahbaz istə; Bu məşhur*

*bir məsəldir, Seyyida, "Qaz vur, qazan doldur".* S.Ə.Şirvani.

◊ **Qaz yerişi yerimək** – 1) qaz kimi yan basa-basa yerimək; 2) təkəbbürlə yerimək, təşəxxüslə yerimək. **Qazdan ayıq** – çox ayıq, gözüaçıq və işini bilən adam haqqında.

**QAZ**[2] [*fr.*] *kim.* 1. Ayrı-ayrı hissəcikləri bir-biri ilə çox zəif bağlı olan və sərbəst surətdə hərəkət edib hər tərəfi qaplamağa qabil olan fiziki cisim, maddə. *Təbii qaz. Boğucu qaz. – Mədənlərdən, neft quyularından çıxan qazların işlənməsi nəticəsində qaz benzini alınır..* Məmmədəliyev. *Yerdən çıxan qazı qədim adamlar ilahi bir şey hesab edirdilər.* M.Hüseyn. // Binaları qızdırmaq, işıqlandırmaq, yaxud mühərrik qüvvə kimi işlətmək və s. məqsədlər üçün istifadə edilən qaza və ya buğaoxşar maddələrin ümumi adı. *Teatr qazla işıqlandırılır. Təbii qaz ən ucuz yanacaqdır. Qaz fənəri. – Lətifə tez-tələsik qaz pilətəsini yandırdı.* M.Hüseyn.

2. Mədədən çıxan qazaoxşar ifraz.

◊ **Qazı qaçmaq** *dan.* – işi baş tutmadığına görə əhvalı pozulmaq, pərt olmaq, ovqatı təlx olmaq. *Müdirin ovqatı qarışmışdı; ..Nicatın qazı qaçmışdı.* Mir Cəlal.

**QAZ**[3] *is.* [*fr.*] Yarımşəffaf ipək parça. // Bu parçadan tikilmiş və ya qayrılmış. *Qaz örtü. Qaz şərf.*

**QAZAĞI**[1] *sif.* Qazaq formasında. *Qazağı paltar. Qazağı papaq.*

**QAZAĞI**[2] *is. mus.* Azərbaycan oyun havalarından biri (Azərbaycanın Qazax şəhərinin adından).

**QAZAX** *is.* Qazaxıstanın əsas əhalisini təşkil edən türkdilli xalq və bu xalqa mənsub adam.

**QAZAXCA** *sif.* və *zərf* Qazax dilində. *Qazaxca qəzet. Qazaxca danışmaq.*

**QAZAQ** *is.* 1. Bax **kazak**.

2. Çar Rusiyasında: ayrıca bir təbəqə təşkil edən atlı qoşunun süvarisi, nəfəri. *Şuşa naçalnikinin qazaqları Nəbini axtarmağa başladılar.* "Qaçaq Nəbi". *Şəban qapını açdı. Neçə nəfər polis əmələsi və qazaqlar daxil oldular.* Ə.Haqverdiyev. *Hər gün küçələrdə ox kimi gözümüzə batan qorodovoy və qazaqlardan əsər yox idi.* A.Şaiq.

**QAZAQBAŞI** *is. tar.* Qazaq zabiti, qazaq dəstəsinin başçısı.

**QAZAQYANA** *is. etnoqr. məh.* Köhnə məişətdə: toy adətlərindən birinin adı. *Gəlin aparan zaman o məhəllənin adamları faytonun qabağını kəsərdi. Onlar oğlan adamından xələt almayınca gəlini aparmağa qoymazdılar. Bu adətin adına qazaqyana deyərdilər.* H.Sarabski.

**QAZALAQ**[1] *is. məh.* Keçmişdə Abşeronda: təkatlı, ikitəkərli araba növü. *Abşeronda qazalaq adlanan bir araba dayanmışdı yolda və Əlimürsəl kişi ilə o qazalağa minmişdik..* Ə.Məmmədxanlı.

**QAZALAQ**[2] *is.* Quş növlərindən biri. *Göy ot bitib, gül açıb, yaz gəlib, oxur qazalaq; Qışı çıxardıb uşaqlar, qaçırlar çay-çəmənə.* Şəhriyar.

**QAZALAQÇI** *is. məh. köhn.* 1. Qazalaq sürücüsü, yaxud qazalaq sahibi.

2. Qazalaq qayıran usta.

**QAZAMAT** *is.* [əsli *ital.*] Dustaqxana, həbsxana. *Qazamat istidir, yata bilmirəm; Qıçımda qandalaq, qaça bilmirəm.* "Qaçaq Nəbi". *Dağ aşıb, düzə gəlləm; Sürmə çək gözə, gəlləm; Yüz il qazamat çəksəm; Çıxcağın sizə gəlləm.* (Bayatı).

**QAZAMATI** *sif. köhn.* Qazamata məxsus, məhbuslara məxsus. [Sonqulu] *əynində uzun qazamatı şinel həbsxanadan çıxarkən, izdiham bunun məğrurluğuna .. təəccüb edirdi.* H.Sarabski.

**QAZAN** *is.* İçində xörək bişirmək, su qaynatmaq və s. üçün böyük girdə metal qab. *Mis qazan. Aş qazanı. Qulplu qazan. Buxar qazanı. – Qazan olmayan yerdə güvəc də qazandır.* (Ata. sözü). *Ocaq daşının üstündə iri qazandan plov qoxusu gəlirdi.* Ə.Vəliyev. ☐ **Qazan asmaq** – qazanda xörək bişirmək. *Oxudular fatihə əmvat üçün; Neçə qazan asdılar xeyrat üçün.* S.Ə.Şirvani.

◊ **Qazan qaynatmaq** – iş düzəltmək, təşəbbüs etmək, hazırlıq görmək, zəmin hazırlamaq. [Məşədi Püstə:] *Qoy, qonşumuz Kəblə Paşanın yasından başım ayılsın, mən bir qazan qaynadaram ki.* H.Sarabski.

**QAZANAOXŞAR** bax **qazanvari**. *Bu adamın çox gülünc görünüşü vardı. Başında*

*qablama qazanaoxşar Buxara dərisindən qara papaq var idi*. H.Sarabski.

**QAZANC** *is.* 1. Qazanılan, əldə edilən şey; fayda, xeyir. *Bundan heç bir qazanc yoxdur. Bunun qazancı nədir?* – [Fatma xanım:] *Mənim axır qazancım budurmu?* N.Vəzirov. // Qənimət. *Dünyadan xoş keçən bir gün aparaq; Qazancdır gəncliyin hər xoş nəğməsi.* S.Vurğun.

2. İşləməklə, çalışmaqla əldə edilən şey, nəticə, səmərə. *Öz əməyinin qazancını görmək. Qazanc dalısınca getmək.* ☐ **Qazanca çatmaq** – 1) xeyir əldə etmək, fayda görmək. [Almaz:] *Bu onun öz faydasıdır. Həm oxuyacaq, həm də qazanca çatacaqdır.* C.Cabbarlı; 2) qazanmaq, qazanc əldə etmək. *Əymə əyər, mənfəət ilə satar; Pul qazanar, yaxşı qazanca çatar.* A.Səhhət. // Gəlir, mədaxil. [Heydər bəy:] *Deyək ki, toy istəmədin, axır gərəkməz ki, mənim bir qazanc yolum ola, çörək istəməzsənmi?* M.F.Axundzadə. *Atabala sözünə davam edərək: – Bilirəm, mənim azacıq qazancım səni yaxşı yaşada bilmir, – dedi*. A.Şaiq.

3. Qoyulmuş xərc ilə əldə edilən gəlir arasındakı fərq; mənfəət. *Mal satışından alınan qazanc.* – [Hacı Qara:] *Beş yüz manat nağd pul verəsən, faydasından, qazancından əl çəkəsən, mayan da əlinə gəlməyə, bu harada görülübdür?* M.F.Axundzadə.

**QAZANCLI** *sif.* Gəlirli, mədaxilli, faydalı, istifadəli, mənfəətli. *Qazanclı iş. – Keykavusun din xadimlərinə münasibəti də qəribədir. O, din xadimi olmağı ən faydalı, ən xeyirli və ən qazanclı sənət hesab edir.* "Qabusnamə".

**QAZANCSIZ** *sif.* Qazancı, gəliri olmayan; gəlirsiz, faydasız.

**QAZANÇA** *kiç*. Balaca qazan, yüngül qazan. *Səlim .. yanaşı iki qara daş qoyub, qazançanı onların üstündə asmışdı.* M.Hüseyn. *Qazançalar danqıldadı, qaşıqlar cingildədi, hərə bir tərəfə səpələnib aşpazdan aldıqları xörəyi yeməyə başladılar.* İ.Şıxlı.

**QAZANÇI** *is.* 1. Mis və ya başqa metaldan qazan qayıran usta.

2. Buxar qazanlarını quran usta.

3. Buxar qazanlarını qızdıran və ona qulluq edən fəhlə.

**QAZANÇILIQ** *is.* Qazançı sənəti, peşəsi.

**QAZANDIRMA** "Qazandırmaq"dan *f.is.*

**QAZANDIRMAQ** *f.* Qazanmasına, əldə etməsinə, çatmasına səbəb olmaq, vasitə olmaq, kömək etmək, nail etmək. *Siz mənə ömrümdə* [görə] *bilməyəcəyim bir səadəti qazandırdınız*. M.S.Ordubadi.

**QAZANXANA** *is. xüs*. Buxar qazanlarının olduğu bina, yer. [Salamov:] *Adə, .. qazanxanadan dünən çıxmışsan, qazamatdan bu gün qaçmışsan, sən də mənə kələk gəlirsən!* C.Cabbarlı. [Qəhrəman:] *Mən istəyirəm, bizim məktəbin taxtapuşundan başlamış qazanxanasına qədər hər şeyi və işi öz yerində olsun*. S.Rəhimov.

**QAZANILMA** "Qazanılmaq"dan *f.is.*

**QAZANILMAQ** *məch.* Əldə edilmək. *Bilik və məlumat çox əmək nəticəsində qazanılır.* – [Qətibə Hüsaməddinə:] *Əziz dostum, həyatda sıçramaq qorxulu bir cəsarətdir. Mərtəbələr tədrici bir surətdə qazanılır.* M.S.Ordubadi.

**QAZANILMIŞ** *f.sif.* Əldə edilmiş. [Laçın bəy:] *Tanıyıram, yaxşı tanıyıram.. Tamam ömürlərində bir gün-gecə halal zəhmət ilə qazanılmış tikə yeməyiblər..* N.Vəzirov. [Kürd Əhməd:] *Mərdimazarçılıqla qazanılmış bir çörəyi yeyib tox olmaqdansa, acından ölmək yaxşıdır.* M.İbrahimov.

**QAZANMA** "Qazanmaq"dan *f.is.*

**QAZANMAQ** *f.* 1. İşləməklə, çalışmaqla əldə etmək. *Kərbəlayı Məmmədəli iki il yarımdır ki, qürbətə çıxıb, az-çox çörək pulu qazansın*. C.Məmmədquluzadə. // Fayda götürmək, udmaq. *Oyunu kim qazandı?*

2. Qazanc əldə etmək, qazanc götürmək. [Səlimi:] *Ağayi-Hikmət İsfahani, Tehranda oturmuşsunuz, ticarət kontorlarınız işləyir, .. yüz min tümənlərlə qazanırsınız.* M.İbrahimov.

3. Ümumiyyətlə, əldə etmək, nail olmaq. *Hörmət qazanmaq. Müvəffəqiyyət qazanmaq*. – [Firidun] *tez bir zamanda darülfünun tələbələri arasında özünə hörmət və məhəbbət qazanmışdı.* M.İbrahimov. *Tapdıq qazmaçılar arasında öz mehribançılığı ilə şöhrət qazanmış məşhur bir usta idi.* M.Hüseyn. // Yiyələnmək, sahib olmaq. *Elmü ürfan qazanmağa getdiyi yerdə; Əsir oldu, aşıq oldu bir qumral qıza*. Ə.Cavad.

**QAZANTƏMİZLƏYƏN** *is.* və *sif. xüs*. Zavod və s. sənaye müəssisələrində buxar

qazanlarını təmizləyən. *Fayton da indi bir ətək pul istəyir, – deyə qazantəmizləyən Əhməd donquldandı*. C.Cabbarlı.

**QAZANVARİ** *sif.* Şəkilcə, görünüşcə qazana oxşayan; qazan kimi. *Bəlkə Müqim bəy Cavanşir öz döşüaçıq kostyumunu geyəydi, başına qazanvari papaqlardan birini qoyaydı, əlinə də xanımın şəhərdən gətirdiyi üstü zərlə işlənmiş çəliyi götürəydi.* S.Rəhimov.

**QAZAYAĞI** *is. bot.* Əsasən isti ölkələrdə yetişən və azacıq kərəviz qoxusuna malik olan yeyilən bir bitki. *Nəsib dayı özündən iri olan qızlardan geri qalmamağa çalışır, bıçağını çıxardıb gah taxılın içində qazayağı dərər, gah yol kənarındakı ilanotunu yolar, gah da yemlik yeyərdi.* İ.Şıxlı.

**QAZDIRILMA** "Qazdırılmaq"dan *f.is.*

**QAZDIRILMAQ** "Qazdırmaq"dan *məch*.

**QAZDIRMA** "Qazdırmaq"dan *f.is.*

**QAZDIRMAQ** *icb.* 1. Qazma işi gördürmək. *Quyu qazdırmaq. Arx qazdırmaq*.

2. Polad qələm və s. ilə taxta, metal, daş və s. üzərində naxış, oyuq açdırmaq, həkk etdirmək. *Üzüyün üzərində öz adını qazdırmaq*.

**QAZEL** *is.* [*rus*.] Yük avtomobillərinin bir növü.

**QAZHOLDER** *is.* [*ing*.] *tex*. Qazları toplayıb saxlamaq üçün gülləyəoxşar anbar.

**QAZI** *is.* [*ər*. qazi] Müsəlmanlarda dini məhkəmə işlərinə baxan ruhani, şəriət hakimi. *Qazıya yalnız gedən razı gələr.* (Ata. sözü). *Şəban gedib qazıdan təvəqqe etdi ki, onu bir növ Məşədi Məmməd Vəli ilə barışdırsın.* Ə.Haqverdiyev.

**QAZICI** *sif.* və *is.* 1. Qazan, yerqazan. *Qazıcı maşın*.

2. Həkk edən, naxışaçan, oyan, oyucu.

**QAZIXANA** *is.* [*ər*. qazi və *fars*. ...xanə] Qazı divanxanası, şəriət məhkəməsi. [Şamama xanım:] *Əgər siz istəyirsiz, mən bu saat özüm gedim qazıxanaya*. N.Vəzirov.

**QAZIQ** *sif.* Qazılmış, çuxur. *Qazıq yer.*

**qazıq-qazıq** 1) *zərf Qazıq-qazıq etmək. Təpənin bir sajın genişliyində yeri qazıq-qazıq olmuşdu*. H.Nəzərli; 2) *sif.* b a x **qazıq**. *Qazıq-qazıq yerlər*.

**QAZIQUMUQ** *is.* Dağıstan xalqlarından birinin adı və bu xalqa mənsub adam.

**QAZILIQ** *is. din*. Qazının işi, vəzifəsi.

**QAZILMA** "Qazılmaq"dan (1-ci mənada) *f.is.*

**QAZILMAQ** 1. "Qazmaq"dan *məch. Tətil başlanandan bir neçə gün əvvəl qazılıb qurtarmış təzə quyu hələ də fontan vururdu.* M.Hüseyn.

2. Nəqş edilmək, həkk edilmək. *Qızıl suyu ilə üstünə cəli xətlər qazılmış.* A.Səhhət. *Sola və sağa açılan qapıların yanında lalə kimi, divara qazılmış dördkünclü işləmələr vardı.* M.İbrahimov.

**QAZIMA** "Qazımaq"dan *f.is.*

**QAZIMAQ** *f.* 1. Kəskin bir alətlə bir şeyin səthindəki şeyi qoparmaq, qaşıyıb çıxartmaq. *Qazıyıb təmizləmək. Taxtanı bıçaqla qazımaq. Dəftəri qazımaq olmaz.*

2. B a x **qazmaq**[1].

3. *məc.* Küt ülgüclə üzünü qırxarkən dərisini soymaq, qoparmaq.

**QAZINMAQ** b a x **qazılmaq** 2-ci mənada.

**QAZINTI**[1] *is.* 1. Yer altından qazımaqla çıxarılan mədən və s. faydalı süxurlar. *Təbiətdə faydalı qazıntılara ya ayrı-ayrı minerallar, ya da bir mineraldan ibarət olan süxurlar şəklində təsadüf edilir*. M.Qaşqay.

2. Qədim dövrlərə aid maddi mədəniyyət əsərlərini, yaxud heyvan qalıqlarını yer altından qazıb çıxarma işi. *Qazıntı işləri. Qazıntı nəticəsində tapılan qədim şəhərin qalıqları. – Türbənin daxilində aparılan qazıntı zamanı döşəmənin altında qəbirlər açılmış və burada dəfn edilmiş 7 adamın skeletləri meydana çıxarılmışdır*. Salamzadə. // Ən qədim geoloji dövrlərdə yaşamış, indi isə yerin dərin qatlarından tapılan heyvanların, bitkilərin qalıqları. *Heyvanların qazıntı halında tapılan qalıqları göstərir ki, keçmiş zamanlarda yaşamış heyvanlar indi yaşayan heyvanlardan fərqli imişlər*. "Ümumi zootexniya".

**QAZINTI**[2] *is.* 1. Bir yerin və ya şeyin qazılmasından hasil olan qırıntı, tör-töküntü. *Ət taxtası qazıntısı. Təknə qazıntısı.*

2. Yazının qazılmış, bıçaq və s. ilə pozulmuş yeri.

**QAZIT(DIR)MA** "Qazıt(dır)maq"dan *f.is.*

**QAZIT(DIR)MAQ** *icb.* Qazdırma işi gördürmək.

**QAZİ**[1] *is.* [*ər.*] b a x **qazı**.

**QAZİ**[2] *sif.* və *is. köhn.* Qəza edən, düşmənə qarşı müharibə edərək qalib gələn (xüsusilə din yolunda müharibə edən). *..Qazilər deyən şah mənəm*. Xətayi.

**QAZİLİK**[1] b a x **qazılıq**.

**QAZİLİK**[2] *is.* Qazi ünvanı (adı) (b a x **qazi**[2]). *Biz imam qullariyüz sadiqanə; Şəhidlik, qazilik nişanımızdır.* Xətayi.

**QAZ-QAZ** b a x **qaz**[3].

**QAZLANMA** "Qazlanmaq"dan *f.is.*

**QAZLANMAQ** *f.* 1. B a x **qazlaşmaq**. // Köpüklənmək, qabarcıqlar əmələ gəlmək.

2. *məch.* Bir mayenin içərisinə qaz daxil edilmək.

3. *dan.* Öyünmək, qürrələnmək, təşəxxüslənmək, coşmaq, xoruzlanmaq.

**QAZLAŞDIRILMA** "Qazlaşdırılmaq"dan *f.is.*

**QAZLAŞDIRILMAQ** *məch. xüs.* 1. Qaz halına salınmaq, qaza çevrilmək.

2. Mayenin içərisinə qaz daxil edilmək, qaz hopdurulmaq. *İndiyədək yarım milyon şüşədən çox qazlaşdırılmış badamlı satılmışdır.* (Qəzetlərdən).

**QAZLAŞDIRMA** "Qazlaşdırmaq"dan *f.is.*

**QAZLAŞDIRMAQ** *f. xüs.* 1. Qaz halına çevirmək, qaza çevirmək.

2. Bir mayenin içərisinə qaz daxil etmək, qaz hopdurmaq.

**QAZLAŞMA** *xüs.* "Qazlaşmaq"dan *f.is. Quyuda görünən qazlaşma və ya su gəlmə əlamətləri quyuda vəziyyətin mürəkkəbləşdiyini göstərir*. Quliyev.

**QAZLAŞMAQ** *f. xüs.* Qaz halına gəlmək, qaza çevrilmək.

**QAZLI** *sif.* 1. İçərisində qaz olan. *Kəndin yaxınlığında olan qazlı torpaqların alovunda yandırılan daş karxanasının xırda tozları Suraxanını əhəng yuvasına çevirmişdi*. H.Sarabski. // Qaz hopdurulmuş, qaz daxil edilmiş; köpüklənən. *Qazlı sular. Qazlı limonad.*

2. *məc. dan.* İddialı, təşəxxüslü, lovğa. *Qazlı adam. Qazlı-qazlı* (z.) *danışmaq*.

**QAZLILIQ** *is. geol*. Qazlı şeyin halı, içində qaz olma.

**QAZLİFT** [*ing.*] *xüs*. Sıxılmış neft qazının təzyiqi ilə quyudan neft çıxaran qurğu.

**QAZMA**[1] 1. "Qazmaq[1]"dan *f.is. Qazma texnikasının inkişafı.*

2. *sif.* Oyulmuş, həkk olunmuş. *Qazma möhür. Qazma naxış*.

3. *sif.* Quyu qazmağa məxsus; neft və s. quyusu qazan. *Qazma texnikası. Qazma alətləri. Qazma ustası. – Tək-tənha qazma buruğu sahildən çox uzaqda, dənizin ortasında tikilmişdi*. M.İbrahimov. *Qazma ustası Qafar dayı quyunu başa çatdırmaq üçün bir neçə gün idi ki, evə getməmişdi.* M.Süleymanov.

4. *is.* Neft və s. çıxarmaq üçün qazılan quyu; şaxta. *Neft sahələrinin dərin kəşfiyyat qazmasında dəzgahların sayı ikiqat artmışdır*.

5. *is.* Torpaq qazmağa məxsus saplı alət. *Çıxar damə beş-on fəhlə, əlində qazma və balta*. M.Möcüz. *Güldanə ilə Bənövşənin əlində qazma, .. Gülxarla Gülşənin əlində bel var idi.* Ə.Vəliyev.

**QAZMA**[2] *is.* Yeraltı daxma, yerin altında qazılmış müvəqqəti, ya daimi ibtidai ev, yaşayış yeri. *Gecədən xeyli keçmiş, yeraltı qazmada qırıq bir şam işığında Ulduz anasına .. məktub yazırdı*. Ə.Məmmədxanlı. *Kaşanələr ağaların, qazma bizim, viran bizim; Eyş onların, nuş onların, zəhər bizim, qətran bizim.* M.Müşfiq.

**QAZMAÇI** *is.* Qazma qazan fəhlə, mədən quyusu qazan fəhlə; şaxtaçı. *Qazmaçılar əyilib quyuya baxdıqdan sonra: – Bu quyu qarın sallayıb, indicə uçacağam deyir.* A.Şaiq. *Danışan qazmaçı bir neçə kəlmə ilə sözünü qurtardı.* M.İbrahimov.

**QAZMAÇILIQ** *is.* Qazmaçı sənəti, qazma işi.

**QAZMADÜSƏR** *is. məh*. Yer qazmağa məxsus alət. *Əlisa yarızarafat, yarı ehtiyatla hərlənib qazmadüsər, bel, balta, kərki, mişar və qeyri karastı toplanmış anbara girdi*. S.Rəhimov.

**QAZMAQ**[1] *f.* 1. Hər hansı bir alət ilə torpağı qaldırıb yeri oymaq, oyuq açmaq, dərinləşdirmək, çuxurlaşdırmaq. *Quyu qazmaq. Arx qazmaq. Xəndək qazmaq. Qəbir qazmaq. Ağacın dibini qazmaq. Səngər qazmaq. – Bakı şəhərində .. quyu qazdıqları zaman dəniz səthindən aşağıda daşla döşənmiş bir yol çıxmışdır*. A.Bakıxanov.

2. Polad qələm və s. ilə oymaq, həkk etmək, naxış açmaq. *Mərmər üzərində şairin adını qazmaq. Mis üzərində naxışlar qazmaq.*

**QAZMAQ²** *is.* Bişmişin, qazanın, qabın və s.-nin dibinə yapışıb bərkişmiş hissəsi, qazılıb çıxardılan ən sonuncu hissəsi. *Aş qazmağı. Çörək qazmağı. – Plovun da ətri evi bürüyüb,* [müsəlman] *qazanın qazmağını zarat-zarat ilə qopardırdı.* C.Məmmədquluzadə.

**QAZMAQCIQ** *kiç.* Nazik qazmaq, kiçik qazmaq.

**QAZMAQLANMA** "Qazmaqlanmaq"dan *f.is.*

**QAZMAQLANMAQ** *f.* Qazmaq tutmaq, qazmaq bağlamaq, dib tutmaq. *Qazanın dibi qazmaqlandı.*

**QAZMAQLI** *sif.* Qazmağı olan, qazmaq bağlamış. *Qazmaqlı aş. Qazmaqlı quymaq.*

**QAZNAQ** *is.* Qazılmış yer, çuxur yer; qazıq, çuxur. *Təpənin dibindəki bulağın üstünə endim, əl və üzümü yuyub qaznağın qırağında oturdum.* A.Divanbəyoğlu.

**QAZ(O)GENERÁTOR** [*fr.* qaz və *lat.* generator] Bərk və ya duru yanacağı qızğın qaz halına salmaq üçün aparat.

**QAZ(O)GENERATORLU** *sif. xüs.* Qazogeneratoru olan. *Qazogeneratorlu yük avtomobili.*

**QAZOLÍN** [*xar.*] Neftin distilləsindən və ya neft qazının mayeləşdirilməsindən alınan duru yanacaq, yaxşı təmizlənməmiş benzin.

**QAZÓN** [*fr.*] Bağlarda, parklarda və s. yerlərdə bəzək üçün əkilmiş və başı dümdüz kəsilmiş ot sahəsi. *Bulvarların qazonları.*

**QAZOYL** *is.* Qaz və neft sözlərinin birləşməsindən yaranan söz.

**QAZÖLÇƏN** *is. xüs.* Laboratoriyalarda və s.-də müxtəlif qazları toplamaq, saxlamaq və həcmlərini ölçmək üçün cihaz.

**QAZSIZLAŞDIRILMA** "Qazsızlaşdırılmaq"dan *f.is.*

**QAZSIZLAŞDIRILMAQ** *məch.* Qazsız hala gətirilmək, qazdan təmizlənmək.

**QAZSIZLAŞDIRILMIŞ** *f.sif.* 1. *xüs.* Qazsız hala gətirilmiş, qazı çıxardılmış.

2. *hərb.* Zərərsiz hala gətirilmiş, qazdan təmizlənmiş.

**QAZSIZLAŞDIRMA** *xüs.* "Qazsızlaşdırmaq"dan *f.is.*

**QAZSIZLAŞDIRMAQ** *f.* 1. *xüs.* Bir şeyin içində olan qazları müxtəlif vasitələrlə çıxarmaq, onu qazsız etmək.

2. *hərb.* Mexaniki və kimyəvi üsullarla zəhərləyici maddələrin təsirini zərərsizləşdirmək.

**QAZSIZLAŞMA** "Qazsızlaşmaq"dan *f.is.*

**QAZSIZLAŞMAQ** *f. xüs.* Qazsız hala gəlmək, qazı boşalmaq, qazı uçmaq (çıxmaq).

**QAZSOĞANI** *is. bot.* Zanbağa oxşar bəzək bitkisi. *Qazsoğanı cinsinin çiçək yanlığı altı sərbəst yarpaqdan təşkil olunmuşdur, yarpaqlar içəri tərəfdən sarı rəngli və parlaqdır, bəzən ağımtıl rənglidir, onların xarici tərəfində yaşıl rəngli enli zolaq vardır.* Qədirov.

**QE** "Q" hərfinin və bu hərflə işarə olunan səsin adı.

**QEYB** [*ər.*] 1. Hazır və göz önündə olmama; qaiblik. ☐ **Qeyb etmək** – itirmək, əldən çıxarmaq. *Hərgah siz buna razılıq versəniz, burada qeyb edə biləcəyiniz bu qiymətli şeyləri də özünüzlə bərabər salamat apara biləcəksiniz!* M.S.Ordubadi. **Qeyb olmaq** – gözdən itmək, yox olmaq, aradan çıxmaq. *Kəklik onun əlindən ox kimi çıxdı və bir anda ormanın yarpaqları arasında qeyb oldu.* A.Şaiq. [Mirzə Valeh] *abasını çiyninə atdı, ayaqqabılarını dəyişdirdi, pilləkən aşağı tırıq-tırıqla düşüb, qaranlıq içində qeyb oldu.* S.Rəhimov. **Qeybə çəkilmək** – b a x **qeyb olmaq**. *Çox xırdalar bərk ayaqda qeybə çəkilir; Böyük dərdlə vuruşana böyük deyildi.* M.Araz.

2. Dinə görə gözlə görünməz olan ruhi aləm; aləmi-qeyb. *Böylə qaranlıq dama daş atmaq, ya qeybdən səadət ummaq, əcəba hansı divanənin xəyalından keçər!* S.Hüseyn. // Məchul və naməlum şeylər, görünməz və bilinməz hal.

**QEYBƏT** *is.* [*ər.*] 1. Birinin (özü olmadığı halda) haqqında danışma, yaxud əleyhinə söz söyləmə, dalınca danışma. *Məcalı qeybətə olmaz o kəs ki, əhli-sənətdir.* S.Ə.Şirvani. *Gecəgündüz işi qeybət o cahil qızların, Möcüz! Əgər vaiz qoya məşğul olarlar elm ilə qızlar.* M.Möcüz. ☐ **Qeybət etmək (eləmək, qırmaq)** – birinin (özü olmadığı halda) sözünü danışmaq, haqqında söz söyləmək, dalınca danışmaq. *Dalda qeybət, üzdə səna etmərəm; Gizli söyüş, zahir dua etmərəm.* M.Ə.Sabir. [Yaqub] *..oyun əsnasında onun mədənində xidmət edən əski mühəndisi haqqında qeybət edərdi.* B.Talıblı. *Sahildə qız-*

*lar, gəlinlər toplanıb onun-bunun qeybətini qırırdılar*. M.Hüseyn.

2. Meydanda olmama, qaib olma, qaiblik. *Ol gün ki, yox idi məndə qüdrət; Qıldın mənə qeybətimdə rəğbət.* Füzuli.

**QEYBƏTCİL** *sif.* Qeybət etməyi sevən.

**QEYBƏTÇİ** *is.* Qeybət edən, dalca danışan, dedi-qoduçu. [Bahar Mahmuda:] *Mən tənbələm? Mən qeybətçiyəm?* Ə.Haqverdiyev.

**QEYBƏTÇİLİK** *is.* Qeybətçi adamın xasiyyəti, söz gəzdirmə xasiyyəti, dedi-qoduçuluq.

**QEYD**[1] *is.* [*ər.*] 1. Qısa surətdə yazma. *Bloknotda edilən qeydlər. – ..Gözləri yazı stolunun üstündəki qeydlərinə sataşdı.* M.Hüseyn. // Kitab və s. haşiyəsində, yaxud altında edilən işarə və ya yazılan yazı. *Səhifənin altında çoxlu qeyd var*. // Bir şeyi hesaba almaq və ya qanuni şəklə salmaq üçün onu müəyyən qaydada dəftərə və s.-yə yazma. *Qeyd zamanı Mahmud qızın tərəfindən, yoldaşı da oğlan tərəfindən vəkil olacaqdı*. B.Talıblı. ☐ **Qeyd etdirmək** – dəftərə saldırmaq, yazdırmaq. *Adını siyahıya qeyd etdirmək*. **Qeyd etmək** – 1) yadda saxlamaq üçün qısaca yazmaq. *Çıxışları qeyd etmək. Mühazirənin mühüm yerlərini qeyd etmək. Dəftərinə bəzi qeydlər etmək;* 2) işarə etmək, yazmaq. *Gecikənləri qeyd etmək. Gəlməyənlərin adını siyahıya qeyd etmək;* 3) göstərmək, nəzərə çarpdırmaq, yada salmaq, söyləmək. *Kütlələrin aktivliyini qeyd etməmək olmaz. – Bunların hamısı qabaqcıl adamlardır, – deyə katib iftixarla qeyd etdi*. Ə.Sadıq. **Qeyd olunmaq** – 1) yazılmaq, siyahıda və s.-də öz adını yazdırmaq; 2) göstərilmək, işarə edilmək. *Məktubun tarixi qeyd olunmamışdır.* **Qeydə alınmaq** – bir yerə yazılmaq, siyahıya daxil edilmək. **Qeydə almaq** – bir yerə yazmaq, siyahıya daxil etmək. *Ancaq mühəndislər bu ocağı qeydə almışdılar*. Mir Cəlal.

2. Bir şey haqqında şifahi və ya yazılı qısa fikir. *Lütfən, qeydlərinizi də bizə bildirsəniz, nəzərə alarıq*. M.İbrahimov.

**QEYD**[2] *is.* [*ər.*] Fikir, qayğı, narahatlıq, əndişə. *Ah, bilməm neyləyim, qurtulmaq olmaz qeyddən*. Füzuli. *Sabira! Ey əsiri-qeydibəla! Şeirdir gərçi şiveyi-şüəra.* M.Ə.Sabir. *Bir tərəfdən qızın qeydi yox idi*. Ə.Haqverdiyev. ☐ **Qeydinə qalmaq** – qayğısını çəkmək, fikrini çəkmək, dərdinə qalmaq, birinin taleyi üçün narahat olmaq. *Cümləmiz siçan kimi evlərimizin deşiklərinə soxulub, öz canımızın qeydinə qalırıq*. C.Məmmədquluzadə. *Buna görə də ailə sahibi olana qədər qeydinə qalmaq mənim vəzifəmdir.* M.S.Ordubadi. *Hər kəs öz qohum-əqrəbasını aramağa məşğul olub, Qaraca qızın qeydinə qalan yox idi.* S.S.Axundov. **Qeydini çəkmək** – b a x **qeydinə qalmaq**. *Gəl çəkmə cahan qeydini sən, can belə qalmaz.* M.V.Vidadi. *Sən oğlunu məndən istə. Mənə vermisən, payımdır, qoy qeydini mən çəkim*. Mir Cəlal.

**QEYDÇİ** *is.* Qeyd edən, siyahıya alan; idarəyə gələn və oradan göndərilən kağızları dəftərə qeyd edən işçi.

**QEYDÇİLİK** *is.* Qeydçi vəzifəsi və işi.

**QEYDEDİCİ** *is. fiz*. Hər hansı bir hadisəni qeyd edən cihaz.

**QEYDKEŞ** *sif.* [*ər.* qeyd və *fars.* ...keş] Qeydə qalan, qayğı çəkən, diqqətli, mehriban. *Qeydkeş ata. – Yaraları qeydkeş əllərlə sarınıb sağalan döyüşçülər xəstəxananı tərk edib, yenidən cəbhəyə qayıtdı*(*lar*). Ə.Məmmədxanlı. [Əsgər bəy:] *..Məndən bu halədək bir elə əməl sadir olmayıbdır ki, o əmələ görə mənim adım millət qeydkeşi qoyulsun.* Ə.Haqverdiyev.

**QEYDKEŞLİK** *is.* Qeyd çəkmə, qeydə qalma, qayğıya qalma; qayğıçılıq. *Qeydkeşlik göstərmək. Ata-ananın öz övladlarına qarşı qeydkeşliyi. Zəhmətkeşlərin tələblərinə qeydkeşliklə* (z.) *yanaşmaq*.

**QEYDLİ** *sif.* Qayğılı, qayğısı olan, hər bir şeyin fikrini çəkən.

**QEYDSİZ** *sif.* 1. Qayğısı, fikri, dərdi, qəmi olmayan; hər şeyi qulaqardına vuran; laqeyd. *O, çox qeydsiz adamdır.* [Mirzə:] *Balalarım, dünyada mən çox ömür etmişəm. Sizin yolunuzda nə qədər çalışıb məramıma çatmışam və xatircəm, qeydsiz dünyadan gedirəm.* Ə.Haqverdiyev.

2. B a x **qeydsiz-şərtsiz**.

**QEYDSİZLİK** *is.* Qeydsiz adamın halı; qayğısızlıq.

**QEYDSİZ-ŞƏRTSİZ** *zərf* Heç bir şərt olmadan, heç bir məhdudlaşdırıcı şərt olmadan; sözsüz. *Qeydsiz-şərtsiz təslim olmaq. Şərtlər qeydsiz-şərtsiz qəbul edildi*. – [Oğlan:] *Rütbəcə özündən böyüklərin əmrini qeydsiz-şərtsiz yerinə yetirmək!* İ.Məlikzadə.

**QEYR** [*ər.*] bax **qeyri** 3-cü mənada. *Edəsən qeyr ilə seyri-gülüstan; Xəstə Zakir qala külxan içində*. Q.Zakir.

**QEYRƏT** *is.* [*ər.*] 1. Vətən, xalq, ailə namusu; ən əziz və müqəddəs sayılan bir şeyin təəssübünü çəkmə, şərəfini, heysiyyətini qoruma. *Vətən qeyrəti. – Gəl, ana yurdumun qızı, gəlini! İndi hünər vaxtı, qeyrət dəmidir.* S.Vurğun. [Cabbar:] *Qeyrət! Varlı balasında qeyrət olmaz, pul olar, sərvət olar, qeyrət, namus olmaz*. B.Talıblı. ☐ **Qeyrətinə toxunmaq** – heysiyyətinə toxunmaq, təhqir etmək. *Əslinə baxsan, bu gerilik şəxsən onun* [Cəmilin] *qeyrətinə də toxunurdu*. M.Hüseyn.

2. Fövqəladə səy, cəhd; çalışma. *Bu işi görmək üçün qeyrət lazımdır. – Başa gəlir elədiyin niyyətlər; Gər saf ilə doğru qeyrət eylərsən*. M.V.Vidadi. *Çünki bilir: rahət əziyyətdədir; Şad yaşamaq səydə, qeyrətdədir*. M.Ə.Sabir.

3. Səbir, dözüm, mətanət; bir bəla və fəlakət qarşısında mərdcəsinə durma.

**QEYRƏTKEŞ** *sif.* və *is.* [*ər*. qeyrət və *fars*. ...keş] Qeyrət çəkən; vətən, xalq, ailə namusu çəkən (adam).

**QEYRƏTLƏNDİRMƏ** "Qeyrətləndirmək"dən *f.is.*

**QEYRƏTLƏNDİRMƏK** *f.* Qeyrətə gətirmək, ruhlandırmaq, ürəkləndirmək.

**QEYRƏTLƏNMƏ** "Qeyrətlənmək"dən *f.is.*

**QEYRƏTLƏNMƏK** *f.* Qeyrətə gəlmək, səy etmək, cəhd etmək, ruhlanmaq, fəaliyyətə gəlmək, cəsarətə gəlmək, ürəklənmək.

**QEYRƏTLİ** *sif.* Öz vətəninin, xalqının, yaxın adamlarının qeyrətini çəkən, şərəf və namusunu qoruyan. *Hər birimiz guya millətin ən qeyrətli hamisi, canıyananı donuna girib zəmanə aslanı, qəhrəmanı oluruq.* C.Məmmədquluzadə. *Haşım qeyrətli və çalışqan adam olduğundan, bir gün rahat oturmurdu*. B.Talıblı.

**QEYRƏTMƏND** [*ər*. qeyrət və *fars*. ...mənd] *köhn.* bax **qeyrətli**. *Qeyrətmənd və sahibi-namus şəxs belə səltənətdən ar edər və belə padşahlardan bizar olar.* M.F.Axundzadə.

**QEYRƏTPƏRƏST** [*ər*. qeyrət və *fars*. ...pərəst] bax **qeyrətli**.

**QEYRƏTSİZ** *sif.* Qeyrəti, namusu, heysiyyəti olmayan. *Dərdlərimiz daha da; Ürəkdə köz-köz olur; Bu haqdır, ağladıqca; Kişi qeyrətsiz olur*. B.Vahabzadə.

**QEYRƏTSİZLİK** *is.* Qeyrəti, namusu, heysiyyəti olmama. [Şahların] *qəfləti və qeyrətsizliyi üzündən vətənimiz .. ən acınacaqlı bir vəziyyətə düşmüşdür.* M.F.Axundzadə.

**QEYRİ** 1. *qoş.* Başqa. *Səndən qeyri. Ondan qeyri. Əhməddən qeyri heç kəsin yazısı hazır deyil. – Ey sevdiyim, səndən qeyri kimim var?* M.V.Vidadi. // Sif. mənasında. *Bahadır qeyri bir halətdə idi.* N.Nərimanov.

2. *sif.* Özgə, yad, kənar, başqa. *Qeyri adamlara içəri daxil olmaq qadağandır. Qeyri şəxslərin bilməsinə icazə yoxdur.* // *sif.* Kənar, işə, məsələyə aid olmayan. *Qeyri söhbətlərlə vaxtını almaq. – Heç o körpə olmasaydı; Bəlkə səni görməzdim mən; Qəbristanı ev etsən də; Qeyri məna verməzdim mən.* M.Araz.

3. *is.* Başqa adam, başqası. // Cəm şəklində: **qeyriləri** – başqaları, digərləri, o biriləri. *Qoy qeyrilərinə də dərs olsun. Elmi işçiləri, yazıçıları və qeyrilərini də bu işə cəlb etmək lazımdır. – Qonşuların cəhd eləsə sənətə; Yetsə də qeyriləri hürriyyətə; Vermə qulaq söhbəti-milliyyətə..* M.Ə.Sabir.

**qeyri** bir para sözlərin qabağına gətirilərək "olmayan" mənasında mürəkkəb sifət və zərf düzəldilir; məs.: qeyri-təbii, qeyri-rəsmi, qeyri-iradi.

**QEYRİ-ADİ** *sif.* [*ər.*] Adi olmayan, adətdən kənar, fövqəladə, görünməmiş. *Qeyri-adi istedad. Qeyri-adi sevinc. Qeyri-adi gözəllik. – Muradlı onun üzünə baxıb qeyri-adi* (z.) *halda qaqqıldadı*. Mir Cəlal. *Səməd Əzizə baxdı. Dostunun sifətində qeyri-adi bir sevinc əlaməti duyulurdu*. Ə.Vəliyev. // Qəribə, təəccüblü. *Qeyri-adi iş. Qeyri-adi adam.*

**QEYRİ-ADİLİK** *is.* Qeyri-adi şeyin halı; adətdən kənar olma; qeyri-adi hal, qeyri-adi şey (hadisə). *İlyas bu gün hər tərəfdə bir qeyri-adilik hiss edirdi.* M.S.Ordubadi.

**QEYRİ-ANTAQONİST** *sif.* [*ər*. qeyri və *yun*. antaqonist] *fəls*. Antaqonist olmayan. *Qeyri-antaqonist ziddiyyət.*

**QEYRİ-BELƏ** *sif. dan.* Başqa cür. *Belədir, ya qeyri-belə?*

**QEYRİ-BƏDİİ** *sif.* [*ər.*] Bədii olmayan. *Qeyri-bədii əsər.*

**QEYRİ-BƏDİİLİK** *is.* Qeyri-bədii şeyin halı.

**QEYRİ-BƏRABƏR** *sif.* və *zərf* Bir bərabərdə olmayan, bir bərabərdə getməyən. *Qeyri-bərabər inkişaf. – Qeyri-bərabər döyüşdən qalib çıxa bilməyəcəklərini başa düşdükdən sonra əsgərlər ağ bayraq qaldırdılar.* İ.Şıxlı.

**QEYRİ-BƏRABƏRLİK** *is.* Qeyri-bərabər olma.

**QEYRİ-CAİZ** *sif.* [*ər.*] *köhn.* Caiz olmayan, icazə verilməyən, rüsxət verilməyən; qadağan.

**QEYRİ-CİDDİ** *sif.* Ciddi olmayan, ciddiyyətsiz. *Qeyri-ciddi adam. – Musiqili əsərlərin zərəri və öz tərbiyəvi roluna görə drama nisbətən üçüncü dərəcəli əhəmiyyətə malik olması haqqındakı söhbətləri sadəcə olaraq musiqi sənətinə qeyri-ciddi münasibət kimi izah edirəm.* Ü.Hacıbəyov.

**QEYRİ-CİDDİLİK** *is.* Ciddi olmama; qeyri-ciddi iş, hərəkət, söz; ciddiyyətsizlik.

**QEYRİ-ELMİ** *sif.* [*ər.*] Elmi prinsiplərə əsaslanmayan, elmə zidd olan, həqiqi elmə aid olmayan, elmdən uzaq olan. *Qeyri-elmi mübahisə. Qeyri-elmi məsələ. Qeyri-elmi nəzəriyyə. Məsələnin qeyri-elmi* (z.) *qoyuluşu.*

**QEYRİ-ELMİLİK** *is.* Elmi prinsiplərə əsaslanmama, elmə aid olmama, elmə zidd olma, elmdən uzaqlıq.

**QEYRİ-ƏDƏBİ** *sif.* [*ər.*] Ədəbi olmayan, qaba, kobud, vulqar. *Qeyri-ədəbi söz, ifadə.*

**QEYRİ-ƏDƏBİLİK** *is.* Qeyri-ədəbi olma, qabalıq, vulqarlıq. *Sözün qeyri-ədəbiliyi.*

**QEYRİ-ƏXLAQİ** *sif.* [*ər.*] Əxlaq normalarına zidd olan, əxlaq qaydalarına uymayan.

**QEYRİ-FƏAL** *sif.* [*ər.*] Fəal olmayan, passiv.

**QEYRİ-HƏQİQİ** *sif.* [*ər.*] Doğru olmayan, həqiqi olmayan; saxta. // Yalançı, səmimi olmayan. *Qeyri-həqiqi dost.*

**QEYRİ-ƏSGƏRİ** b a x **qeyri-hərbi**.

**QEYRİ-HƏQİQİLİK** *is.* Doğru olmama, həqiqi olmama; saxtalıq.

**QEYRİ-HƏRBİ** *sif.* [*ər.*] Hərbi olmayan; mülki. *Qeyri-hərbi obyektlər.*

**QEYRİ-HƏYATİ** *sif.* [*ər.*] Həyati olmayan, real olmayan; lazım olmayan, yaxud həyata keçirilməsi mümkün olmayan. *Qeyri-həyati təklif. Qeyri-həyati layihə.*

**QEYRİ-HƏYATİLİK** *is.* Qeyri-həyati şeyin halı.

**QEYRİ-İCTİMAİ** *sif.* [*ər.*] İctimai olmayan.

**QEYRİ-İXTİYARİ** b a x **qeyri-iradi**. *Qeyri-ixtiyari gülüş. Qeyri-ixtiyari ağlamaq. Qeyri-ixtiyari ayağa qalxdı.* – [Vaqif] *qeyri-ixtiyari olaraq əlini pəncərəyə tərəf hərləyəndə güldana toxunub saldı.* Çəmənzəminli. *Hamının gözü qeyri-ixtiyari olaraq bu əcaib şeyə dikilmiş.* M.Rzaquluzadə.

**QEYRİ-İNSANİ** *sif.* [*ər.*] İnsan qüvvəsi, insan bacarığı xaricində olan; fövqəladə. *Qeyri-insani bir qüvvə ilə.*

**QEYRİ-İRADİ** *sif.* [*ər.*] İradəsindən, arzusundan asılı olmayan. *Qeyri-iradi gülüş. Qeyri-iradi hərəkət.* // *zərf.* İradəsiz olaraq, iradəsindən asılı olmayaraq; ixtiyarsız, bilməyərək, qeyri-şüuri, xəbəri olmadan, istər-istəməz. *Qeyri-iradi gülmək. Qeyri-iradi hərəkət etmək. Qeyri-iradi diksinmək. – Kipiani qeyri-iradi gülümsündü və şlyapasını çıxardıb azacıq təzim etdi.* İ.Şıxlı.

**QEYRİ-İRADİLİK** *is.* Qeyri-iradi olma, iradədən asılı olmama. *Hərəkətin qeyri-iradiliyi. Gülüşün qeyri-iradiliyi.*

**QEYRİ-KAFİ** *sif.* [*ər.*] Kifayətsiz, kifayət etməyən, bəs olmayan, təmin etməyən. *Qeyri-kafi miqdarda pul.* // Pis. *Qeyri-kafi qiymət.* // Zərf mənasında. *Yerli komitənin işi qeyri-kafi hesab olundu.*

**QEYRİ-KAFİLİK** *is.* Qeyri-kafi şeyin halı; kifayətsizlik, azlıq; qənaətbəxş olmama.

**QEYRİ-KAMİL** *sif.* [*ər.*] Kamil olmayan, mükəmməl olmayan, yetkin olmayan, bitkin olmayan; yetişməmiş, nöqsanlı, qüsurlu, natamam, naqis.

**QEYRİ-KAMİLLİK** *is.* Qeyri-kamil şeyin halı və keyfiyyəti; nöqsanlılıq, naqislik, qeyri-mükəmməllik.

**QEYRİ-QABİL** *sif.* [*ər.*] 1. Mümkün olmayan, həyata keçirilə bilməyən. *Həyata keçirilməyə qeyri-qabil iş.*

2. Bir işə bacarığı olmayan, qabil olmayan, qabiliyyəti olmayan; qabiliyyətsiz, istedadsız. *Musiqiyə qeyri-qabil adam.*

**QEYRİ-QABİLLİK** *is.* Qabil olmama, qavramamazlıq, istedadsızlıq, qabiliyyətsizlik.

**QEYRİ-QANUNİ** *sif.* və *zərf* [*ər.*] Qanunsuz, qanundan kənar, qanundan xaric, qanuna zidd. *Qeyri-qanuni hərəkət. Qeyri-qanuni hərəkət etmək.*

**QEYRİ-QANUNİLİK** *is.* Qanuni olmama, qanuna zidd olma.

**QEYRİ-QƏNAƏTBƏXŞ** *sif.* və *zərf* [*ər.*] Hər hansı bir tələbə cavab verməyən, qane etməyən; yarıtmaz, kifayətsiz, pis. *Qeyri-qənaətbəxş iş. O, hələ indiyədək qeyri-qənaətbəxş işləyir.*

**QEYRİ-QƏTİ** *sif.* və *zərf* [*ər.*] Qəti olmayan. *Qeyri-qəti hərəkət. Qeyri-qəti cavab vermək.*

**QEYRİ-QƏTİLİK** *is.* Qəti olmama, qeyri-qəti şeyin halı. *Cavabın qeyri-qətiliyi.*

**QEYRİ-LAYİQ** *sif.* [*ər.*] Layiq olmayan, münasib olmayan, namünasib, yaraşmaz, ləyaqətsiz.

**QEYRİ-LEQAL** *sif.* [*ər.* qeyri və *fr.* leqal] Leqal olmayan, gizli şəraitdə işləməyə məcbur olan, qanunən yol verilməyən. *Qeyri-leqal qəzet. Qeyri-leqal dərnək. Qeyri-leqal mətbəə. Qeyri-leqal iş şəraiti.*

**QEYRİ-MADDİ** *sif.* [*ər.*] *fəls.* Maddi olmayan; mənəvi.

**QEYRİ-MADDİLİK** *is.* Qeyri-maddi şeyin halı və keyfiyyəti; maddi olmama.

**QEYRİ-MƏCBURİ** *sif.* [*ər.*] Məcbur olmayan, könüllü. *Qeyri-məcburi dərs. – Təzkirəli mütəxəssislər (doktorlar, mühəndislər və dava vəkilləri) öz ana dillərindən və öz tarix və ədəbiyyatlarından bixəbərdirlər. Və bunun yeganə səbəbi o dərslərin hökumət məktəblərində qeyri-məcburi olmasıdır.* A.Səhhət.

**QEYRİ-MƏCBURİLİK** *is.* Qeyri-məcburi olma, məcburi olmama.

**QEYRİ-MƏHDUD** *sif.* [*ər.*] 1. Həddi-hüdudu olmayan, ucsuz-bucaqsız, sonsuz. *Qeyri-məhdud səhralar, düzənliklər.*

2. Heç bir şeylə məhdudlaşdırılmayan. *Qeyri-məhdud ixtiyar. Qeyri-məhdud hakimiyyət. Qeyri-məhdud səlahiyyət.*

**QEYRİ-MƏHDUDLUQ** *is.* Qeyri-məhdud olma, həddi-hüdudu olmama, qeyri-məhdud şeyin halı. *Hakimiyyətin qeyri-məhdudluğu.*

**QEYRİ-MƏHSULDAR** *sif.* [*ər.*] 1. Məhsuldar olmayan, məhsul verməyən, bəhər verməyən, artım verməyən.

2. *dilç.* Sözlər və şəkilçilər haqqında: yeni sözlər əmələ gətirməyən, yaxud çox az əmələ gətirən. *Qeyri-məhsuldar şəkilçi.*

**QEYRİ-MƏHSULDARLIQ** *is.* Qeyri-məhsuldar şeyin halı.

**QEYRİ-MƏQBUL** *sif.* [*ər.*] Qəbul oluna bilməyən, bəyənilməyən, yararsız. *Qeyri-məqbul dəlil. Qeyri-məqbul iş. Qeyri-məqbul təklif. Qeyri-məqbul şərtlər.* // Pis. *Qeyri-məqbul qiymət.*

**QEYRİ-MƏQBULLUQ** *is.* Məqbul olmama, qəbula keçməmə, qəbul edilə bilməmə.

**QEYRİ-MƏLUM** *sif.* [*ər.*] Məlum olmayan, bəlli olmayan, tanınmayan. *Qeyri-məlum ada. Əsərin qeyri-məlum müəllifi.*

**QEYRİ-MƏMNUN** *sif.* [*ər.*] Məmnun olmayan, razı olmayan, xoşnud olmayan.

**QEYRİ-MƏMNUNLUQ** *is.* Qeyri-məmnun olma, məmnunsuzluq, xoşnudsuzluq.

**QEYRİ-MƏNTİQİ** *sif.* Məntiqə zidd olan; ziddiyyətli, ardıcıl olmayan. *Qeyri-məntiqi mühakimə. Qeyri-məntiqi ifadə.*

**QEYRİ-MƏSKUN** *sif.* [*ər.*] Məskun olmayan, adam yaşamayan. *Qeyri-məskun yerlər.*

**QEYRİ-MÖTƏBƏR** *sif.* [*ər.*] Mötəbər olmayan, etibar edilə bilməyən. *Qeyri-mötəbər xəbərlər.*

**QEYRİ-MÜƏYYƏN** *sif.* [*ər.*] Müəyyən olmayan, dəqiqləşdirilməmiş, müəyyən edilməmiş. *Qeyri-müəyyən istiqamət. Qeyri-müəyyən vaxt. Qeyri-müəyyən şərtlər.* // Tam aydın və müəyyən olmayan, qəti olmayan, naməlum. *Qeyri-müəyyən cavab. Qeyri-müəyyən rənglər. – Şiraslansa indi qeyri-müəyyən bir vəziyyətdə qalmışdı.* S.Rəhimov.

**QEYRİ-MÜƏYYƏNLİK** *is.* Qeyri-müəyyən şeyin hal və vəziyyəti.

**QEYRİ-MÜKƏMMƏL** *sif.* [*ər.*] Mükəmməl olmayan, tamamlanmamış, təkmilləşməmiş; bitməmiş, yarımçıq. *Qeyri-mükəmməl rəsm. Qeyri-mükəmməl üsul.*

**QEYRİ-MÜKƏMMƏLLİK** *is.* Qeyri-mükəmməl şeyin halı; natamamlıq, yarımçıqlıq.

**QEYRİ-MÜMKÜN** *sif.* [*ər.*] Mümkün olmayan, imkansız, imkan xaricində olan, həyata keçirilə bilməyən. *Qeyri-mümkün iş.*

**QEYRİ-MÜMKÜNLÜK** *is.* Mümkün olmama, imkan xaricində olma, həyata keçirilə bilməmə.

**QEYRİ-MÜNBİT** *sif.* [*ər.*] Münbit olmayan, bitkini yaxşı bitirməyən, məhsul verməyən, bərəkətsiz. *Qeyri-münbit torpaq. Qeyri-münbit sahə.*

**QEYRİ-MÜNBİTLİK** *is.* Qeyri-münbit torpağın halı; bərəkətsizlik.

**QEYRİ-MÜNTƏZƏM** *sif.* [*ər.*] Müntəzəm olmayan, tərtibsiz, nizamsız. *Qeyri-müntəzəm qoşun. – Üzəngilər qeyri-müntəzəm* (z.) *bir halda cingildədi*. M.Hüseyn.

**QEYRİ-MÜNTƏZƏMLİK** *is.* Qeyri-müntəzəm şeyin halı; tərtibsizlik, nizamsızlıq. *Hərəkətin qeyri-müntəzəmliyi.*

**QEYRİ-MÜTƏHƏRRİK** *sif.* [*ər.*] Bir yerdən başqa yerə köçürülə bilməyən, yerindən tərpədilə bilməyən, hərəkət etməyən.

**QEYRİ-MÜTƏHƏRRİKLİK** *is.* Qeyri-mütəhərrik şeyin halı.

**QEYRİ-MÜTƏNAHİ** *sif. köhn.* İntəhasız; sonu-axırı olmayan.

**QEYRİ-MÜTƏNAHİLİK** *is. köhn.* Sonsuzluq, intəhasızlıq, sonu-axırı olmama.

**QEYRİ-MÜTƏNASİB** *sif.* [*ər.*] Mütənasib olmayan; bir-biri ilə uyğun olmayan, tutmayan. // Aralarında nisbət olmayan.

**QEYRİ-MÜTƏNASİBLİK** *is.* Qeyri-mütənasib şeyin halı; bir-biri ilə uyğun olmama, tutmama.

**QEYRİ-MÜTƏŞƏKKİL** *sif.* [*ər.*] Təşkil olunmamış; mütəşəkkillikdən, təşkilatdan məhrum. *Qeyri-mütəşəkkil kütlə. Qeyri-mütəşəkkil çıxış. Qeyri-mütəşəkkil iş. Qeyri-mütəşəkkil* (z.) *hərəkət etmək.*

**QEYRİ-MÜTƏŞƏKKİLLİK** *is.* Qeyri-mütəşəkkil şeyin halı. *Konsertin qeyri-mütəşəkkilliyi nəzərə çarpdı.*

**QEYRİ-MÜVAFİQ** *sif.* [*ər.*] Müvafiq olmayan, uyğun olmayan, münasib olmayan, məqsədə uymayan.

**QEYRİ-NİZAMİ** *sif.* [*ər.*] Nizami olmayan. *Qeyri-nizami qoşun*. // *zərf* Nizamsız bir surətdə, heç bir nizam və qaydaya riayət etmədən.

**QEYRİ-NİZAMİLİK** *is.* Qeyri-nizami qoşunun halı.

**QEYRİ-NORMAL** *sif.* [*ər.* qeyri və *lat.* normal] Normal olmayan, adi normadan kənara çıxan; qeyri-adi. *Qeyri-normal hal. Qeyri-normal hərəkət. Qeyri-normal vəziyyət.*

**QEYRİ-NORMALLIQ** *is.* Qeyri-normal olma; qeyri-normal vəziyyət, hal. *Vəziyyətin qeyri-normallığı.*

**QEYRİ-REAL** *sif.* [*ər.* qeyri və *lat.* real] Real olmayan, gerçək olmayan, həyati olmayan, həyata keçirilə bilməyən.

**QEYRİ-REALLIQ** *is.* Real olmama, həyati olmama, həyata keçirilə bilməmə. *Təklifin qeyri-reallığı.*

**QEYRİ-RƏSMİ** *sif.* [*ər.*] Rəsmi olmayan, rəsmiyyətə salınmamış, rəsmi cəhətdən əhəmiyyəti olmayan. *Qeyri-rəsmi məlumat. Qeyri-rəsmi bəyanat. Qeyri-rəsmi tələb. Qeyri-rəsmi* (z.) *bildirmək, elan etmək. –* [Məmmədbağır] *əvvəl fikrində bunu tutmuşdu ki, Sitarəni "qeyri-rəsmi" surətdə alsın*. S.Hüseyn.

**QEYRİ-RƏSMİLİK** *is.* Qeyri-rəsmi olma, rəsmi olmama. *Məlumatın qeyri-rəsmiliyi.*

**QEYRİ-SABİT** *sif.* [*ər.*] Sabit olmayan, möhkəm olmayan, qərarsız.

**QEYRİ-SABİTLİK** *is.* Sabit olmayan şeyin halı.

**QEYRİ-SƏMİMİ** *sif.* [*ər.*] Səmimi olmayan, öz həqiqi hiss və fikirlərini gizləyən, ikiüzlü, riyakar. *Qeyri-səmimi adam. Qeyri-səmimi* (z.) *hərəkət etmək.*

**QEYRİ-SƏMİMİLİK** *is.* Səmimi olmama, ürəkdən gəlməmə; səmimi olmayan iş, hərəkət, münasibət; ikiüzlülük, riya.

**QEYRİ-SİMMETRİK** *sif.* Simmetrik olmayan, mütənasib olmayan.

**QEYRİ-ŞƏFFAF** *sif.* [*ər.*] Şəffaf olmayan, şəffaflıqdan məhrum. *Qeyri-şəffaf şüşə. Naftalan yağabənzər, qatı, qeyri-şəffaf bir mayedir.*

**QEYRİ-ŞƏFFAFLIQ** *is.* Qeyri-şəffaf şeyin halı, xassəsi.

**QEYRİ-ŞÜURİ** *zərf* [*ər.*] Düşünmədən, düşünülmədən, bilmədən; qeyri-ixtiyari, qeyri-iradi. *Qeyri-şüuri söyləmək. Qeyri-şüuri halda demək. – Bəzən arxada qalan atlıya* [atlılardan biri] *acıqlanaraq, qeyri-şüuri bir halda əlini qaldırıb çadırın zərli sütununa çırpırdı*. Çəmənzəminli. // Sif. mənasında. *Qeyri-şüuri iş. Qeyri-şüuri hərəkət. – Sonra, tamamilə qeyri-şüuri bir hərəkətlə irəlilədim, çayniki götürüb özümə çay tökdüm.* İ.Əfəndiyev.

**QEYRİ-ŞÜURİLİK** *is.* Qeyri-şüuri olma, qeyri-iradilik, qeyri-ixtiyarilik.

**QEYRİ-TƏBİİ** *sif.* [*ər.*] 1. Təbii olmayan, qeyri-adi. *Qeyri-təbii səs. Qeyri-təbii* (z.) *səslə bağırmaq. – Bahadırın yaşına uyğun gəlməyən ciddiyyəti nə üçünsə qocaya qeyri-təbii görünmürdü.* M.Hüseyn. *Çox yatmaq təriflənəsi adət deyildir: bədəni süstləşdirər, xasiyyəti yerindən oynadar, insanın sifətini təbii halından çıxarıb, qeyri-təbii hala salar.* "Qabusnamə".

2. Süni. *Qeyri-təbii gülüş. Qeyri-təbii sevinc. Qeyri-təbii* (z.) *gülmək*.

**QEYRİ-TƏBİİLİK** *is.* Qeyri-təbii şeyin halı; sünilik.

**QEYRİ-TƏNQİDİ** *sif.* [*ər.*] Tənqidi olmayan, tənqidə əsaslanmayan. *Qeyri-tənqidi münasibət. Məsələyə qeyri-tənqidi* (z.) *yanaşmaq*.

**QEYRİ-ÜZVİ** *sif.* [*ər.*] Heyvan, ya bitki aləminə mənsub olmayan, həyat prosesləri olmayan; cansız. *Qeyri-üzvi maddələr. Qeyri-üzvi təbiət.* // Bitki, ya heyvan aləminə mənsub olmayan maddələrdən ibarət olan; tərkibinə bu kimi maddələr daxil olan. *Qeyri-üzvi gübrələr. Qeyri-üzvi azot birləşmələri.* ☐ **Qeyri-üzvi kimya** – kimyanın qeyri-üzvi maddələrin tərkibini, xassələrini və bir haldan başqa hala keçməsini tədqiq edən şöbəsi.

**QEYSƏR** *is.* [əsli *lat.*] Qədim Roma və Bizans padşahlarının ünvanı. // Ümumiyyətlə, padşah. *Ərəb meydan oxudu şövkətli qeysərlərə*. Ə.Cavad.

**QEYSƏRLİK** *is. köhn.* İmperatorluq, padşahlıq.

**QEYZ** *is.* [*ər.*] Qəzəb, hiddət, acıq. *Koroğlu qeyz ilə nərə çəkəndə bir ağaclıqdan eşidilirdi.* "Koroğlu". ☐ **Qeyzə gəlmək, qeyzi tutmaq** – hirslənmək, qəzəblənmək, hiddətlənmək, qeyzi tutmaq. *Ağalar elə bir qeyzə gəldilər ki, pulları çırpdılar biçarə Yusif əminin üzünə*. C.Məmmədquluzadə. **Qeyzə gətirmək** – b a x **qeyzləndirmək**.

**QEYZLƏNDİRİLMƏ** "Qeyzləndirilmək"-dən *f.is.*

**QEYZLƏNDİRİLMƏK** *məch.* Qeyzlənməsinə səbəb olmaq, acıqlandırılmaq, hiddətləndirilmək, acığı tutdurulmaq.

**QEYZLƏNDİRMƏ** "Qeyzləndirmək"dən *f.is.*

**QEYZLƏNDİRMƏK** *f.* Acıqlandırmaq, hiddətləndirmək, qəzəbləndirmək, hirsləndirmək, acığını tutdurmaq.

**QEYZLƏNMƏ** "Qeyzlənmək"dən *f.is.*

**QEYZLƏNMƏK** *f.* Hiddətlənmək, qəzəblənmək, bərk acığı tutmaq. [İmamverdi:] *Bəy, namus bir bəyzadələrdə deyil, kasıb-kusubun da özünə görə namusu var və namusum da məni qeyzlənməyə vadar edir*. Ə.Haqverdiyev. *Lakin bu dəfə qarı artıq qeyzlənməyərək, mehriban gözlərini Leylaya qaldırdı*. Ə.Məmmədxanlı.

**QEYZLƏTMƏ** "Qeyzlətmək"dən *f.is.*

**QEYZLƏTMƏK** b a x **qeyzləndirmək**.

**QEYZLİ** *sif.* və *zərf* Hiddətli, acıqlı, hirsli, qəzəbli; hiddət, acıq, hirs, yaxud bərk narazılıq ifadə edən. *Qeyzli baxış. Qeyzli sifət. – Heydər əmi qeyzli çıxardı küçəyə və gəlib yapışardı qulaqlarımdan, qalxızardı göyə.* C.Məmmədquluzadə. *Kassiri qeyzli çağırıb buyurdu ki, "komandir"ə on manat versin*. Ə.Haqverdiyev.

**qeyzli-qeyzli** *zərf* Acıqlı-acıqlı, hiddətlə. *Qeyzli-qeyzli danışmaq. – Lütfəli bəy evinə gəlib, qeyzli-qeyzli gəzinərək öz-özünə deyirdi: – Arvad, dayan, gör mən sənə nə qayıraram*. İ.Musabəyov.

**QEYZNAK** *zərf* [*ər.* qeyz və *fars*. ...nak] *köhn*. Qeyzli surətdə, qeyzlə. *Cütçü baba böylə deyib qeyznak; Eylədi ol qırğını ol dəm həlak.* A.Səhhət.

**QƏBA** *is.* [*ər.*] Keçmişdə adətən mollaların geydiyi uzun paltar, cübbə, don (bəzən **əba-qəba** şəklində işlənir). [Mirzə Şəfi:] *Mən İrandan bir əba, bir qəba ilə gəlmişdim*. Mir Cəlal. *Yaxşısı budur ki, camaat şübhələnməmiş bu əba-qəbanı geyib, buradan çıx get.* "Koroğlu".

**QƏBAHƏT** *is.* [*ər.*] Çirkin iş, çirkin hərəkət, yaraşmaz iş; qüsur, nöqsan, günah. *Əgər qəbahətdir, bunun nisbətini bizə niyə verirsən?* M.F.Axundzadə. *..O saat tutduğu işin qəbahətini anlayıb, o işi bir də tutmaz.* Ə.Haqverdiyev. *Səltənət bilirdi ki, Ceyranın bu hərəkəti böyük və bağışlanmaz bir qəbahətdir*. Mir Cəlal.

**QƏBAHƏTLİ** *sif.* Qəbahəti olan, qüsuru olan. *Qəbahətli olduğuna görə səsini çıxarmır. Qəbahətli eynilərdi çox üzləşənlər; Nadanları tutaşdırıb zövq alan azmı?* M.Araz.

**QƏBAHƏTSİZ** *sif.* Qəbahəti, günahı, qüsuru olmayan.

**QƏBAHƏTSİZLİK** *is.* Qəbahəti, günahı, qüsuru olmama.

**QƏBALƏ** *is.* [*ər.*] *köhn.* Bir mülkün və sairənin alınıb-satılması haqqında rəsmi sənəd. *Bunlar pul təməssükləri, mülk qəbalələri və sair lazımsız kağızlardı.* M.S.Ordubadi. [Həkimülmülk:] *Malımız da, canımız da qurban olsun, sabah qəbaləsini .. təqdim edərəm, – deyib yel kimi özünü çölə atdı.* M.İbrahimov. *Mərdan uşağı içəri çağırıb soruşdu: – Kim var sizdə? – Məşədi Yusif əmi. Qəbalə yazır.* Mir Cəlal.

**QƏBALƏNAMƏ** *is.* [*ər.* qəbalə və *fars.* ...namə] b a x **qəbalə**.

**QƏBALI** *sif. köhn.* Qəba geymiş, əynində qəba olan. *Atlazdan qəbalı, belində şalı; Gövhərdən bahalı üzündə xalı.* Aşıq Ələsgər. *Yer ilə göyün arası, adlarını müctəhid və ruhani qoyan əmmaməli, əbalı, qəbalı həşərat ilə, yırtıcı qurdlarla doludur.* Ə.Haqverdiyev.

**QƏBİH** *sif.* [*ər.*] *köhn.* 1. Çirkin, yaraşıqsız, kifir. *Qəbih üz. Qəbih əndam.*

2. Qəbahətli, nalayiq, yaraşmayan, ləyaqətsiz, pis. *Qəbih söz. Qəbih iş.* – [Qəmər:] *Yox, özgənin məktubunu oxumaq qəbih şeydir.* S.S.Axundov. *Adamlara ləqəb qoymaq keçmişin qəbih adətlərindən biri idi.* H.Sarabski.

**QƏBİL** [*ər.*] Cür, növ, kimi, cins. *Bizim mübarizə apardığımız əmir də bu qəbil adamlardandır.* M.S.Ordubadi. *Qəhrəmani o qəbil insanlardan idi ki, onların fikri bir məsələnin üstündə gərgin işlədiyi zaman xarici aləmdə heç bir şey görməz və eşitməzlər.* M.İbrahimov.

**QƏBİLƏ** *is.* [*ər.*] İbtidai cəmiyyətdə: bir soydan törəmiş və bir rəisin idarəsi altında birlikdə yaşayan köçəri tayfa, nəsil; əşirət, oymaq. *Qəbilə birlikləri. Qəbilə quruluşu.* – [Skiflər] *cəsarətli, vəhşi xasiyyətli və köçəri olan müxtəlif qəbilələrdən ibarət idilər.* A.Bakıxanov. [Müdir səyahətçiləri üçüncü otağa gətirdi:] *Məlumunuz olmalıdır ki, bunların əksəriyyəti cərimə, vergi və hərb təminatı müqabilində alınan qızlardır; çünki qəbilələr bir-birini məğlub etdiyi zaman ələ keçirdikləri qızları və oğlanları satırlar.* M.S.Ordubadi. // *məc.* Tayfa, xalq, millət mənasında. *Qəbiləmiz burda qurub ocağı; İndi olmuş qurd-quşların yatağı..* Şəhriyar.

**QƏBİR** *is.* [*ər.*] Ölüləri basdırmaq üçün xüsusi şəkildə qazılan çuxur: məzar, gor. *Hər cümə axşamı* [Zeynəb] *ərinin qəbri üstə gedib, bir yekə mərəkə qurar.* C.Məmmədquluzadə. ◊ **Qəbri qazılmışdır** – ölümünə az qalmışdır, ölümü yaxınlaşmışdır. **Bir ayağı qəbirdə** – ölümünə az qalmış (adətən çox qoca adam haqqında deyilir). [Səadət xanım:] *Qardaş, biz heyvan deyilik, bizə insan deyirlər. ..Atamızın bir ayağı qəbirdədir, lazımdır ki, biz mane olaq onun vəhşi işlərinə.* N.Vəzirov. **Birinə qəbir qazmaq** *məc.* – birinin əleyhinə işləmək, birini bədbəxt etmək üçün gizlində tədbir görmək, quyu qazmaq.

**QƏBİRDAŞI** *is.* Qəbrin üstünə qoyulan tavadaşı.

**QƏBİREŞƏN** b a x **goreşən**.

**QƏBİRİSTAN** *is.* [*ər.* qəbr və *fars.* ...stan] Qəbirlər olan yer, ölülərin basdırıldığı yer; məzarlıq. *Qəbiristandan ölü qayıtmaz.* (Ata. sözü). *Həmin boz dağda, yol kənarında köhnə xaraba bir qəbiristan vardır.* S.S.Axundov. [Məmməd:] *Evimizdən iki yüz addım o yanda böyük, köhnə bir qəbiristan vardı.* C.Cabbarlı.

**QƏBİRİSTANLIQ** b a x **qəbiristan**. *Qəbiristanlığın girəcəyində Ağası bəy əlini döşünə qoyub xana və məiyyətinə təzim edib döndü.* Çəmənzəminli.

**QƏBİRQAZAN** *is.* 1. Ölüləri basdırmaq üçün qəbir qazan adam. *Ay qəbirqazanlar; gedin ev tikin! Bu qəmli dərədə* ["Qurd ağzı"nda] *plan ki, yoxdur.* N.Kəsəmənli.

2. *zool.* Qəbirləri eşib qazıyan bir cücü, həşərat. // Kaftar, goreşən, sırtlan.

3. *məc.* Ölüm gətirən, məhv edən, məhvini hazırlayan. *Beləliklə, .. burjua quruluşu, "Manifestin" dili ilə desək, öz qəbirqazanlarını doğurmuşdur.* F.Engelsdən.

**QƏBİZ** *is.* [*ər.*] Qarnı bağlanma, mədəsi işləməmə. ◻ **Qəbiz etmək (eləmək)** – qarnını bərkitmək, bağlamaq. **Qəbiz olmaq** – qarnı işləməmək, qarnı bərkimək.

**QƏBİZLİK** *is.* Qəbiz olma, qarnı işləməmə.

**QƏBUL** *is.* [*ər.*] 1. Verilən, təslim edilən, göndərilən, təklif edilən şeyi alma. *Ərizələrin*

*qəbulu başlanır. Teleqramların qəbulu. Malların qəbulu haqqında akt.*

2. Götürmə; öz sıralarına alma, daxil etmə. *İnstituta qəbul.*

3. Söhbət etmək, danışmaq, dinləmək, yoxlamaq, müayinə etmək və s. üçün birini öz yanına buraxma. *Müdirin qəbul saatları. Qəbul otağı* (*gələnlər üçün xüsusi otaq*). – *Adilə bu gün xəstələrinin qəbulundan sonra iş gününü qurtarıb xalatını soyunmaq istəyirdi ki, Xasayoğlu onun yanına, kənd həkim məntəqəsinə gəldi.* Ə.Məmmədxanlı.

◊ **Qəbul etdirmək** – qəbul etməyə məcbur etmək. [Qətibənin] *bu üsyanı təşkil etdiyi zaman Toğrulu qorxutmaq və nəticədə də öz təkliflərini qəbul etdirməyi düşünmüşdü.* M.S.Ordubadi. **Qəbul etmək** – 1) verilən, göndərilən, təslim edilən bir şeyi almaq, götürmək. *Poçtdan məktubları qəbul etmək. Göndərilən şeyləri qəbul etmək;* 2) idarə etməyə başlamaq, bir işi görməyə razı olmaq, vəzifəni tutmaq. *İdarəni qəbul etmək. Direktorluq vəzifəsini qəbul etmək. Yeni vəzifəni qəbul etmək. Şöbəni qəbul etmək;* 3) bir təşkilatın sıralarına, tərkibinə daxil etmək, iştiraka buraxmaq, götürmək. *Həmkarlar İttifaqına qəbul etmək. İnstituta qəbul etmək. İşə qəbul etmək;* 4) söhbət etmək, danışmaq, yoxlamaq, müayinə etmək və s. üçün gələnləri yanına buraxmaq. *Direktor saat 2-də qəbul edəcəkdir. Həkim bu gün 10 xəstə qəbul etmişdir;* 5) gələn adamı (qonağı və s.-ni) lazımi surətdə və ya hər hansı bir tərzdə qarşılamaq, münasibət göstərmək**.** *Qonaqları təntənə ilə qəbul etdilər.* – *Nəsir də* [Mirzə Qədiri] *bir qardaş kimi xoş üzlə qarşılayıb qəbul etmişdi.* S.Hüseyn; 6) təsdiq etmək, səs verməklə öz razılığını ifadə etmək. *Yığıncaq qərar qəbul etdi. Komissiya layihəni qəbul etdi*; 7) içmək, udmaq, atmaq (dərman). *Həbi gündə üç dəfə qəbul etmək lazımdır;* // öz üzərində hər hansı bir müalicə vasitəsi tətbiq etmək. *Vanna qəbul etmək. Duş qəbul etmək.* **Qəbula keçmək** – qəbul edilmək, məqbul hesab edilmək.

**QƏBULÇU** *is.* Göndərilən, ya təhvil verilən malı və s. qəbul edən işçi, xidmətçi. *Zavod sahibi gəlir, qəbulçuya lazımi buyuruq və göstərişlər söyləyir.* H.Nəzərli.

**QƏBULEDİCİ** *sif.* Radio (elektromaqnit) dalğalarını qəbul edən; alıcı. *Qəbuledici radiostansiya.* // *İs. mənasında.* Radio dalğalarını tutub, onları səs halına salan aparat, cihaz.

**QƏBZ** *is.* [*ər.*] Pul, qiymətli şey və sairənin alınması, qəbul edilməsi haqqında verilən kağız, sənəd. *Ev kirəsi qəbzi. Pulu verib qəbz almaq.* – [Allahqulu:] *Bostan pulunu mən istəyəndə, mənə qəbz göstərdilər.* N.Vəzirov. *Bakı cəmiyyəti-xeyriyyəsi elan edir ki, cəmiyyətə üzv olmaq istəyənlər 5 manatlarını gətirib versinlər cəmiyyət xəzinədarına və qəbzlərini alsınlar.* C.Məmmədquluzadə.

**QƏBZƏ** *is.* [*ər.*] Bir şeyin tutulacaq yeri, qulpu, dəstəsi. *Qılıncın qəbzəsi.* – *Zakirin qətlinə bəsdir nigahın; Əl vurma, qəbzeyi-xəncər istəməz.* Q.Zakir. *Qılınc və xəncərlərin gümüş qəbzələri, tüfənglərin bəndləri sönük parıltı saçırdı.* Çəmənzəminli. *Ələmdar titrəyən əlini xəncərinin qəbzəsinə apardı.* S.Rəhimov.

**QƏBZƏLİ** *sif.* Tutacağı, dəstəsi olan; saplı, dəstəli. [Cavanşir:] *Onun qılıncı qızıl qəbzəli olsa da, mən özünə qaytarardım.* M.Hüseyn.

**QƏCƏC** *is. bot.* Dəniz sahili qumluqlarında və şoranlıqlarda bitən kol-bitki.

**QƏCƏLƏ** *is.* Sağsağan.

**QƏCƏRƏ** *is. məh.* Yəhərin üstündən salınan bəzəkli örtü, cecim.

**QƏCƏRƏLİ** *sif. məh.* Üstündən qəcərə salınmış.

**QƏDD** *is.* [*ər.*] 1. Boy, boy-buxun, qamət. *Qəddin ki, sərvi-xuraman ilən bərabərdir.* Qövsi. *Zorbadır hərçənd ki, qəddin sənin; Yox mənə tay olmağa həddin sənin.* M.Ə.Sabir.

2. Bel. □ **Qəddi bükülmək (əyilmək)** – beli bükülmək. *Ala gözlüm, səndən ayrı düşəli; Qədd əyilib, bel bükülüb, huş gedib.* Aşıq Ələsgər. **Qəddi bükülmüş (əyilmiş)** – beli bükülmüş. *Qəddi bükülmüş bu qocanın nəmli nəzəri .. dalğaları sürətlə yararaq gedən bir gəmiyə dikilmişdi.* M.Hüseyn. *Nazimə xalanın saçı ağarmış, qəddi əyilmiş, səsi də .. alçalmışdı.* Mir Cəlal. **Qəddini bükmək (əymək)** – 1) belini əymək, əyilmək. *Müfəttiş əlini döşünə qoyaraq uzun qəddini əydi.* S.Rəhimov; 2) *məc.* bədbəxt etmək, belini qırmaq, sarsıtmaq. *Ey ərənlər, sındırıblar belimi; Möhnət yükü qəddim əyər,*

*ağlaram.* M.V.Vidadi; 3) *məc.* əyilmək, tabe olmaq, alçalmaq. **Qəddini düzəltmək** – 1) belini düzəltmək, ayağa qalxmaq. *Qaçay qəddini düzəldib, yan-yörəsinə baxdı: ətrafda kimsə görünmürdü.* İ.Məlikzadə; 2) *məc.* zülm və əsarətdən qurtarmaq. **Qəddini kaman etmək** – b a x **qəddini bükmək** 2-ci mənada. *Yəqin fəraqın edər qəddimi kəman, getmə!* X.Natəvan.

**QƏDDAR** *is.* və *sif.* [*ər.*] Rəhmsiz, amansız, mərhəmətsiz, zalım. *Qəddar düşmən. – Bütün dövrlərdə müstəbid, qəddar; Ağıldan, kamaldan, fikirdən qorxar.* B.Vahabzadə. // Qatı, yaman, bərk.

**QƏDDARANƏ** *zərf* [*ər.* qəddar və *fars.* ...anə] Amansızcasına, mərhəmətsizcəsinə, insafsızcasına, zalımcasına.

**QƏDDARCASINA** b a x **qəddaranə**.

**QƏDDARƏ** *is.* [*ər.*] *köhn.* Hər iki tərəfi kəsən ağır qılınc. *Nəhayət,* [əlbəyaxa vuruşmalardan] *heç bir şey çıxmazdı, qəddarələr və xəncərlər işə düşərdi.* H.Sarabski.

**QƏDDARLIQ** *is.* Rəhmsizlik, mərhəmətsizlik, amansızlıq, zalımlıq. *Yağıları sevindirdik, bəs eləyər! Al mumluğu; al, qəddarlıq öyrət bizə!* M.Araz.

**QƏDDƏMƏK** *f. dan.* Yonmaq, çərtmək. *Hikmət haradansa çoxlu karandaş gətirib qəddədi, stolun üstünə qoydu.* Mir Cəlal.

**QƏDDƏNMƏK** *məch. dan.* Çərtilmək, yonulmaq.

**QƏDDƏNMİŞ** *f.sif. dan.* Çərtilmiş, yonulmuş.

**QƏDD-QAMƏT** *is.* Boy-buxun.

**QƏDD-QAMƏTLİ** *sif.* Boy-buxunlu.

**QƏDƏH** *is.* [*ər.*] Şərab, su və s. içməyə məxsus qab; piyalə, kasa. *Şərab qədəhi. – Saqi, kərəm eylə, cam gəzdir! Durma, qədəhi müdam gəzdir!* Füzuli. *Bir az sonra şişlik qoxusu, zurna-qaval səsləri, şərab qədəhlərinin cingiltisi bir-birinə qarışdı.* M.Rzaquluzadə.

**QƏDƏHCİK** *is.* Kiçik qədəh, incə qədəh.

**QƏDƏHNUŞ** *sif.* [*ər.* qədəh və *fars.* ...nuş] *klas.* İçki içən, şərab içən. ◻ **Qədəhnuş olmaq** – içki içmək, şərab içmək. *O lalərüxlə qədəhnuş olduğum gecələr.* S.Ə.Şirvani.

**QƏDƏHVARİ** *sif. bot.* Görünüşcə qədəhə oxşayan. *Qədəhvari tac.*

**QƏDƏK** *is. köhn.* Pambıqdan toxunma sadə və ucuz parça, tünd göy rəngə boyanmış bez. *Bazarın bir küncündə tikilmiş dükanın içində qədəkdən, bezdən, şilədən, alçaq çitlərdən tökülübdür.* M.F.Axundzadə. [Hacı Kərim] *əvvəlləri İrana səfər edərək çit, qələmkar və qədək alıb satırdı.* A.Şaiq. [Gülnazın] *əynində çiynindən dizinə qədər uzanan boz qədəkdən tikilmiş bir köynək vardı.* M.İbrahimov. // Bu parçadan tikilmiş. *Xudayar bəy karvansaranın qapısına yetişcək, içəridən bir alçaq, qədək arxalıqlı .. kişi çıxıb, qaşqabaqlı üz tutdu Xudayar bəyə.* C.Məmmədquluzadə.

**QƏDƏM** *is.* [*ər.*] 1. Addım. *Vəsiqəli adamlara hər qədəmdə təsadüf etmək mümkün idi.* M.S.Ordubadi. *Atlar başladılar qədəm ilə getməyə.* Ə.Haqverdiyev. // Saylarla bərabər məsafə bildirir. *Uzaqda bir alaçıq görünür, alaçıqdan on qədəm kənar, kolun dalısında Sona xanım .. o yan-bu yana baxır.* M.F.Axundzadə. [Güldəstə:] *..Zinyət xanım bu dörd divarın arasında qalıb, ikicə qədəm kənara çıxmayıb.* N.Vəzirov.

2. Ayaq. *Nə xoş olardı o saat ki, bəxt üzündən mən; Qədəmlərində ölüb yarımın, verəydim can.* Heyran xanım. *Bir iş görmək xəyalın varsa, qədəmlərini tanıdığın yerlərə qoy.* M.S.Ordubadi. [Əbdüləli bəy:] *O gözəl qədəmlərə baxmaq böyük səadətdir.* C.Cabbarlı. ◻ **Qədəm basmaq (qoymaq)** – 1) ayaq basmaq, daxil olmaq. *Dün naz ilə qədəm basanda bağa; Şimşadü sənubər düşdü ayağa.* Q.Zakir. *Qədəm qoyub yar yanına gələndə; Elə gəl, elə get, yol inciməsin.* Aşıq Abbas; 2) *məc.* başlamaq, şüru etmək, iqdam etmək. *İctimai işlərə yenicə qədəm qoymuş bu qadınlar dəstəsinin başında duran .. qoca bir qadın idi.* S.S.Axundov. *Əhməd həmişəki kimi burada da öz sevdiyi şüarını təkrar edib, icrasına qədəm qoydu.* B.Talıblı.

◊ **Qədəmi yüngül (xoş)** – b a x **ayağı yüngül** (“**ayaq**”da). [Mirzə Salman:] *Bənövşə, yenə də qabağa düşüb yol göstər. Nişanlı qızın qədəmləri yüngüldür.* S.Rəhman. *Yağ, a qar, yağ, qədəmin xoşdur, yağ! Döyünən qəlbimizi coşdur, yağ!* S.Rüstəm. **Qədəmin mübarək (olsun)!** – gələn adamı təbrik üçün işlənir – xoş gəlmisən! [Ağca xanım:]

*Elə həmişə sən gələsən, qədəmin mübarək olsun!* H.Sarabski.

**qədəm-qədəm** *zərf* Addım-addım. *Gəzəcəkdir qəddəm-qədəm bağımı; Görəcəkdir üzümlü çardağımı*. A.Səhhət.

**QƏDƏMƏ** *is.* [*ər.*] Pillə (nərdivanda, pilləkəndə). // *məc.* Səviyyə, dərəcə.

**QƏDƏMLİ** *sif.* Ayağı xeyirli, uğurlu; xoşqədəm. *Mey içdilər hər gələnin sağlığına, .. Güldandakı qızılgülün sağlığına; Xoş qədəmli ayın, ilin sağlığına!* X.Rza.

**QƏDƏMSİZ** *sif.* Ayağı düşərsiz, ayağı düşməz; uğursuz, bədqədəm.

**QƏDƏR**[1] [*ər.*] 1. *is.* Miqdar, say, kəmiyyət. *Hər şeyin qədəri vardır.* // Başqa nitq hissələri ilə (say və əvəzliklərlə) birlikdə qeyri-müəyyən say bildirir. ☐ **Bir qədər** – bir az, qeyri-müəyyən miqdar. *Bir qədər fikirləşdikdən sonra ayağa qalxdı. – Bir qədər pul ki, etdilər saman; Oldular xalq xürrəmü xəndan*. S.Ə.Şirvani. *Sara xanımın hiddətlənməsindən, doğrusu, mən bir qədər qorxdum.* Qantəmir. **Bir bu qədər** – b a x **bu qədər** 1-ci mənada. **Bu qədər** – 1) bu miqdarda (adətən çoxluluq mənasında). *Bu qədər vaxt harada idin? – Neyləmişəm bilməm dövri-zalimə; İncidər düşəndə bu qədər məni.* Q.Zakir. *Bu qədər çətinlik və məhrumiyyətə baxmayaraq, Azərbaycan xalqının istiqlalə olan ümidləri sönməmişdi.* M.S.Ordubadi; 2) bitdi, vəssalam, daha deyəcək söz yoxdur (söhbətə, sözə xitam vermək üçün işlənir). **Nə qədər** – 1) nə miqdar? neçə? neçə dənə? *Paltoya nə qədər vermisən? Kitabxanada nə qədər kitab var? Nə qədər vaxta gedirsən?;* 2) nə dərəcədə, nə nisbətdə. *Qozalar nə qədər çox, nə qədər iri olsa, o qədər yaxşıdır*. Ə.Vəliyev; 3) istədiyin qədər, ürəyin istəyən qədər. *Sənə, yalnız sənə; sənə deməkçün; Könlümdə nə qədər mənim sözüm var.* B.Vahabzadə. **Nə qədər ki...** – o vaxta qədər ki... *Nə qədər ki mənim gözümdə yaş var; Olsun ürəyinin daşına qurban!* M.Müşfiq. **O qədər** – 1) o miqdarda (adətən çoxluluq bildirir). *O qədər kitabı haradan almısan? O qədər şeyi yığmaq mümkün deyil.* – [Qurbanəli:] *Məhəmməd ağa oxumaqdan o qədər dəm vurdu ki, indi də qulağım gur-gur guruldayır.* N.Nərimanov. *O qədər çox ki, böyük işlərimiz; Onu nəql etməyə şerim aciz.* M.Müşfiq; 2) o dərəcədə, o nisbətdə. *Bura o qədər gözəldir ki... Nə qədər lazımsa, o qədər çalışmaq lazımdır.* – [Pristav:] *Doğrusunu de, yoxsa səni yıxdırıb o qədər döydürərəm ki, bir ay yorğan-döşəkdə qalarsan.* Ə.Haqverdiyev. *Hər nə isə, qərəz, bunun da o qədər eybi yoxdur*.. Qantəmir.

2. *qoş.* Təxmin və təqrib mənasında. *Onlar otuz nəfərə qədər adam idi. İclasa iki yüzə qədər adam gəlmişdi.*

3. *qoş.* Bir işin intəhasını, həddini, yaxud davamını bildirir; ...dək, ...kimi. *Axşama qədər səni gözlədim. Gecəni sabaha qədər yatmamışam. – O gün Araz axşama qədər qızdırma içində od tutub yana-yana inlədi.* A.Şaiq. *Kim bilir* [Buğac] *böyüyənə qədər başına nələr gələcək.* M.Rzaquluzadə. // Bir şeyin böyüklüyünü, uzunluğunu, ölçüsünü bildirir. *Topuqlarına qədər uzanmış saç. Dizlərinə qədər.* // Bir yeri digər yerdən ayıran məsafəni, yaxud bir hadisəni digər hadisədən ayıran vaxtı göstərmək üçün işlənir (...dək şəkilçisi ilə də ifadə olunur). *Bakıdan Moskvaya qədər qatarla iki günlük yoldur. Füzulidən Vaqifə qədər olan dövr. – Dilguşa paltosunu çiyninə atıb, darvazaya qədər Mehmanı ötürdü.* S.Rəhimov.

4. *qoş.* Qabaq, əvvəl. *Müharibəyə qədər. Yeni dərs ili başlanana qədər. Dünənə qədər.*

5. *qoş.* Müqayisə mənasında – kimi. *Təbrizin üfüqləri qara keçədən qurulmuş bir alaçığın içi qədər qara idi.* M.S.Ordubadi. *İndi bu balaca kəndciyəz Dilara üçün .. Bakı qədər əzizdi*. Ə.Məmmədxanlı.

**QƏDƏR**[2] *is.* [*ər.*] Tale, qismət, müqəddərat, alın yazısı. *Qədər büküb belimi, eyləyib kəman, ölürəm!* X.Natəvan. *Etiqad etsə qəzayə, qədərə; Ömrünü verdi bu sözlər hədərə.* A.Səhhət. *Vali buyurdu ki, qəm yeməsin çox; Qədər yazdığına bizdə çarə yox*. R.Rza.

**QƏDƏRLƏNMƏK** *f.* Alnına yazılmaq, bəxtinə yazılmaq, qisməti olmaq. *Qəza qədərlənib üz verəndə dərd; Kəməndə düşənə "qaç" demək olmaz.* Aşıq Şəmşir.

**QƏDƏRSİZ** *sif. dan.* Saysız, saysız-hesabsız, saya-hesaba gəlməyən. *Qədərsiz qoşun. Qədərsiz qarışqa*.

**QƏDİM** *sif.* [*ər.*] 1. Çox köhnə zamanlara, çox uzaq keçmişə məxsus və aid olan. *Qədim tarix. Qədim xalqlar. Qədim adətlər. Qədim abidələr. Qədim qala. Qədim mədəniyyət əsərləri.* // Çox köhnə. *Divarda bədənnüma bir cüt qədim güzgü vardı.* S.Hüseyn. *Göylərə baş vuran qədim binalar; Dayanmış əvvəlki əzəmətiylə.* S.Vurğun. *Bibiheybət Bakının qədim neft rayonlarından biri sayılırdı.* M.Hüseyn.

2. *məc.* Köhnə, təcrübəli, əski. [Rəhim bəy] *bir dünyagörmüş, neçə illər polis idarələrində qədim murovlar, pristavlar, naçalniklər yanında xidmət etmiş şirindil, zərif, gödəkboylu, altmış sinnini ötmüş bir kişi idi.* Ə.Haqverdiyev. [Hacı Murad:] *Məhərrəm bəy, .. nə əcəb qədim dostunuzu yadınıza saldınız?* S.S.Axundov.

**QƏDİMDƏN** *zərf* Çox köhnə zamandan, çox köhnə dövrdən bəri, köhnədən, çoxdan, əskidən. *Kəndlilər .. qorxularından uşaqları gərmə qalaqlarının içində gizlədib, uçitelə deyiblər ki, bizim kənddə heç qədimdən uşaq olmaz.* C.Məmmədquluzadə. ☐ **Qədimdən qalma** – qədim dövrlərdən qalma. *Bu dərə alma dərə; Qədimdən qalma dərə; İstərəm bir bağ salam; Yar gələ alma dərə.* (Bayatı).

**QƏDİMİ** *sif.* Köhnə, qədimdən mövcud olan, qədim. *Qədimi qulundur Zakiri-xəstə; Məhəbbət et ona, barı, görəndə.* Q.Zakir. *Keçər ciyərdən, oturmaz o qanlı peykanı; Könül qədimi olan aşinadı, qoyma gedə.* S.Ə.Şirvani.

**QƏDİMLİK** *is.* Qədim zamanlara aid olma; çox köhnəlik. *Bu pulların qədimliyinə şübhə yoxdur. Qız qalasının qədimliyi müəyyən edilmişdir. – Burda qədim nağıldan da qədimlik; "Mənəm" desə, noxtalanar "mənəmlik".* M.Araz.

**QƏDİR**[1] *is.* [*ər.*] Dəyər, qiymət; etibar, hörmət, heysiyyət, ləyaqət. ☐ **Qədr(ini) bilmək** – layiqincə qiymətləndirmək, bir adamın və ya bir şeyin qiymətini, dəyərini, əhəmiyyətini başa düşüb onu qorumaq, mühafizə etmək. *Firaqi çəkməyən aşiq vüsalın qədrini bilməz; Cəmilə olmayan vasil cəmalın qədrini bilməz.* Nəsimi. *Aşıq Ələsgərin qədrini bilsən; Yerin var göz üstə, gəz, qadan alım!* Aşıq Ələsgər. [Tahir:] *Usta, məni o qədər də avam hesab eləmə. Mən zəmanəmizin qədrini yaxşı bilirəm.* M.Hüseyn.

**QƏDİR**[2] *klas.* B a x **qədər**[1] 1-ci mənada. *Sənə nə qədir dedim rəhm qıl mənə, getmə.* X.Natəvan.

**QƏDİRBİLƏN** *sif.* Bir adamın, ya şeyin qiymətini, əhəmiyyətini bilən, başa düşən; yaxşılıq bilən. *Qədirbilən adam. – Odun götür, yaxşı yar; Yaxşı doğra, yaxşı yar; İyidi gümrah eylər; Qədirbilən, yaxşı yar.* (Bayatı).

**QƏDİRBİLMƏZ** *sif.* Adama qiymət qoymayan, adamın qədrini bilməyən; yaxşılıq bilməyən. *Qədirbilməz adam. – Haq bilir ki, səni necə istərəm; Ay bivəfa, qədirbilməz, bəri bax!* M.P.Vaqif. *Gözəlin bəzisi bədniyyət olur; Qədirbilməz olur, bihürmət olur.* Q.Zakir. *Gövhər qalıb qədirbilməz əlində; Tərlan olub sar əlinin dustağı.* Aşıq Ələsgər.

**QƏDİRBİLMƏZLİK** *is.* Adama qiymət qoymama, adamın qədrini bilməmə; yaxşılıq bilməmə. *Qədirbilməzlik, milli etinasızlıq və insan taleyinə biganəlik faktlarından biri də Xəzər dənizində "Merkuri" gəmisində batan iki yüz İran vətəndaşının (sərnişinin) həyat bahasının, qan pulunun İran konsulluğu tərəfindən yüz qırx min rubl müəyyənləşdirilməsi məsələsi idi.* "Hophopnamə".

**QƏDİRDAN** *sif.* [*ər.* qədr və *fars.* ...dan] *köhn.* b a x **qədirbilən**. *Qədirdan adamları, məmləkətin qeydinə qalanları çıraq götürüb qapı-qapı axtarıram.* M.S.Ordubadi.

**QƏDİRDANLIQ** *is. köhn.* b a x **qədirşünaslıq**. [Vəliəhd:] *..Bunları nəzərə alaraq, sizin bu qədər böyük qədirdanlığınızı təşəkkürsüz buraxmaq istəmədim.* M.S.Ordubadi.

**QƏDİR-QİYMƏT** b a x **qədir**[1]. *Napak olan sənin nə bilir qədir-qiymətin; Zatində adəmin dəxi arı göhər gərək.* Nəsimi. *İnsanın ki elmi olmadı, onun nə qədir-qiyməti ola bilər, nə hörməti.* C.Məmmədquluzadə. ☐ **Qədir-qiymətini bilmək** – b a x **qədrini bilmək** ("**qədir**[1]"də). [İmamverdi:] *Mən öz abrımın qədir-qiymətini bilirəm və qızımın rüsvayçılığını heç vədə qəbul etmərəm.* Ə.Haqverdiyev.

**QƏDİRŞÜNAS** [*ər.* qədr və *fars.* ...şünas] b a x **qədirbilən**. *Heyf olsun bivaxt əlimizdən gedən rəfiqəmizə ki, həmişə qədirşünas dostların ürəyində diridir.* Ə.Haqverdiyev.

**QƏDİRŞÜNASLIQ** *is.* Qədir bilmə; bir adamın məziyyətlərini qiymətləndirmə, təqdir etmə, dəyərini, qiymətini anlama.

**QƏDLƏMƏK** b a x **qəddəmək**.

**QƏDLƏNMƏK** b a x **qəddənmək**.

**QƏDLƏNMİŞ** b a x **qəddənmiş**. *Salman qədlənmiş qırmızı karandaşı və bir dəftər götürdü.* S.Rəhimov.

**QƏDLİ-QAMƏTLİ** b a x **qədd-qamətli**. *Dürdanə xanım yaşı altmışa yaxın qədli-qamətli bir arvad idi.* Ə.Əbülhəsən.

**QƏDR** [*ər.*] *klas.* b a x **qədər**[1]. *Xoşdur nə qədr eyləsə yarım cəfa mənə.* Füzuli. *Bir zaman var idi canda ixtiyar; O qədri gəlmədin, ta oldum bimar*. Q.Zakir.

**QƏDTƏZƏ** *sif. dan.* Tamamilə təzə, heç işlənməmiş, istifadədə olmamış. *Qədtəzə paltar. – Elə bil bu saat yenicə topdan kəsilmiş yorğanüzüləri, qədtəzə görünən döşəklər, yastıqlar, mütəkkələr hamısı təmiz idi.* Ə.Vəliyev.

**QƏFƏS** *is.* [*fars.*] 1. Quşları, heyvanları salmaq üçün məftil və ya ağac çubuqlarından düzəldilmiş, ya hörülmüş qutu şəkilli qurğu. *Quş qəfəsi. Toyuq qəfəsi. Tülkünü qəfəsə saldılar. – Pəncərənin qabağında asılan qəfəsin içərisində boz rəngli bir tutuquşu vardır.* M.S.Ordubadi. *Quş, ayağını* [cələdən] *azad etmək üçün dartınırdı və çapalayırdı. Bunu gördükdə biz qaratoyuğun üstünü alırdıq. Sevinə-sevinə aparıb qəfəsə salırdıq.* S.S.Axundov.

2. *məc.* Həbs, həbsxana, zindan, dustaqxana mənasında. *Ruzi-hicrandır, sevin, ey mürği-ruhim, kim, bu gün; Bu qəfəsdən mən səni, əlbəttə, azad eylərəm*. Füzuli. *Oldu sənsiz çəmən, ey gül, məni-şeydayə qəfəs; Nə çəmən, cümlə cahandır məni-rüsvayə qəfəs*. S.Ə.Şirvani. *Gəlin, tez uçuraq o daş qəfəsi; Gülsün qadınlığın ağlayan səsi!* S.Vurğun. ☐ **Qəfəs kimi** – cansıxıcı, darısqal (yer haqqında). *Muğan düzündəki səssiz gecələr; Sıxdı Əmirxanı bir qəfəs kimi.* S.Vurğun. **Qəfəsdə saxlamaq** – azadlıqdan məhrum etmək, dörd divar arasında saxlamaq. [Almaz:] *Biz qadınlarımızı qəfəsdə saxlayan əlləri qırmalı, qadını azadlığa çıxarmalıyıq.* C.Cabbarlı. **Qəfəsdən azad olmaq** – həbsdən azad olmaq, azadlığa çıxmaq, çətinlikdən qurtulmaq. **Qəfəsə düşmək** – tutulmaq, girə keçmək, tora düşmək, ələ keçmək. *Xan qəfəsə düşmüş vəhşi heyvan tək özünü o yanbu yana çırpır.* Ə.Haqverdiyev. **Qəfəsə salmaq** – həbsə salmaq, azadlıqdan məhrum etmək, dörd divar arasında gizlətmək. [Mələk] *hiss edirdi ki, burada, Allahyarın evində qəfəsə salınmış quş kimi yaşayır.* İ.Şıxlı.

◊ **Qəfəsə dönmək** – son dərəcə zəifləmək, arıqlamaq, cansızlaşmaq. *Onun bədəni bir qəfəsə dönmüşdür*. **Quru qəfəs** – çox zəif, üzgün, cansız, arıq adam haqqında. *Gördüm bu dünyanı – quru qəfəsdir; Bizlərə verdiyin ibrətli dərsdir..* N.Kəsəmənli. **Döş (köks) qəfəsi** *anat.* – skeletin, qabırğalardan ibarət olan içərisində ciyərlərin və ürəyin yerləşdiyi döş boşluğunu təşkil edən hissəsi. [Kişinin] *pərələri genişləndi, sinəsi qalxıb-endi, köks qəfəsi az qaldı partlasın*. İ.Şıxlı.

**QƏFƏSƏ** *is.* [*fars.*] 1. B a x **qəfəs**.

2. Kitab və sairə qoymaq üçün mərtəbə-mərtəbə divara bənd edilmiş və bölmələrə ayrılmış taxtalardan ibarət qurğu. *Kitab qəfəsəsi. Dükan qəfəsəsi. – Burada nə yoxdur? ..Qəfəsələrdə top-top çit, parça.* Ə.Əbülhəsən.

3. Nazik taxtadan düzəldilmiş və ya qəfəs şəklində hörülmüş arakəsmə.

4. Döş qəfəsi, döş sümükləri. *Yazığın içini, içalatını elə aparmışdı ki, quruca qəfəsəsi qalmışdı*. S.Rəhimov.

**QƏFƏSƏLİ** *sif.* Qəfəsəsi olan (b a x **qəfəsə** 2-ci mənada). *Qəfəsəli kitabxana. Qəfəsəli dükan*. // Hörgülü, şəbəkəli. *Qadınlara məxsus qəfəsəli lojalar var, bizi kimsə görməz.* A.Şaiq. *Adamlar bir-birinə macal vermədən, son vaqonun dəmir qəfəsəli pəncərəsinə baxa-baxa irəli yeridilər.* Mir Cəlal.

**QƏFİL** *sif.* və *zərf* [*ər.*] Gözlənilməz, ansız, xəbərsiz. *Təzə silah növlərini öyrənmək, tez-tez qəfil basqınla düşməni narahat etmək .. bölüyün əsas məşğuliyyəti idi.* Ə.Əbülhəsən. *Tuturlar onları qəfil atəşə; Gizləyir dostları qalın bir meşə.* M.Rahim.

**QƏFİLCƏ** b a x **qəfildən**.

**QƏFİLDƏN** *zərf* Birdən, birdən-birə, gözlənmədən, xəbərsiz, ansızın. *Qəfildən vurmaq. – Nəbigil qəfildən* [bəylərin] *qabağına çıxıb atlarını saxladılar.* "Qaçaq Nəbi".

*..Qəfildən girən qonaq ev sahibinin xəcalət çəkməsinə səbəb ola bilər.* M.S.Ordubadi. *Birdən tingə başında qəfildən bir dəstə qız onun qarşısına çıxdı.* Ə.Məmmədxanlı.

**QƏFLƏT** *is.* [*ər.*] 1. Qafillik, xəbərsizlik. *Qılma bizi qəflət ilə mədhuş; Həmsöhbətin eyləmə fəramuş.* Füzuli. [Ziba xanım:] *Vay sənin halına, vay sənin halına ki, qəflət gözünü örtübdür.* M.F.Axundzadə. *Bülbül, keçirtmə bağda qəflətdə ömrünü.* S.Ə.Şirvani. ☐ **Qəflətdə olmaq** – xəbərsiz olmaq, bilməmək. *Həqiqətdə də mən öz səmimi dostlarım haqqında qəflətdə olmuşam.* M.S.Ordubadi.

2. Cəhalət, avamlıq. ☐ **Qəflətdə saxlamaq** – qəsdən ayılmağa, başa düşməyə qoymamaq, cəhalətdə saxlamaq.

3. Diqqətsizlik, qeydsizlik, huşsuzluq, səhlənkarlıq. ☐ **Qəflət eləmək (etmək)** – diqqətsizlik, qeydsizlik göstərmək; unutmaq, nəzərdən qaçırmaq; səhlənkarlıq etmək. [Ağa Kərim:] *Ağa Mərdan hər nə istəsə, ona yol tapar; onun müqabilində gərək qəflət eləməmək.* M.F.Axundzadə.

◊ **Qəflət yuxusu** – ətrafında baş verən hadisələrdən tam xəbərsizlik. *Vaiz sözünə tutma qulaq, qafil olma, kim; Qəflət yuxusunun səbəbi ol fəsanədir.* Füzuli. *..Qadından təsadüfi öyrəndiyi əhvalat Xəlili sanki qəflət yuxusundan oyatdı.* M.Hüseyn.

**QƏFLƏTƏN** *zərf* [*ər.*] Qəfildən, birdən, gözlənmədən, xəbərsiz, təsadüfən. [Müsyö Jordan:] *Əlbəttə, sehrdir, mat qalmalı işdir, bir türfətüleyndə qəflətən Parij xarab olubdur.* M.F.Axundzadə. *Su kənarında qəflətən naçar; Bir quzu bir gün oldu qurda düçar.* A.Səhhət. *Atamın qəflətən ölümü sağalmaz bir yara kimi uzun müddət qəlbimi ağrıtdı.* A.Şaiq.

**QƏHƏR** *dan.* b a x **qəhr**. *Uşaqların belə kədərli ağlamasını görüncə Gövhərə qəhər üz verirdi.* Ə.Vəliyev.

**QƏHƏRLƏNMƏ** "Qəhərlənmək"dən *f.is.*

**QƏHƏRLƏNMƏK** *f.* Acıq çəkmək, hiddətlənmək, acığından boğulmaq. // Mütəəssir olmaq, kədərlənmək, kövrəlmək, doluxsunmaq, boğula-boğula ağlamaq. *Bu sözlərdən sonra qadın qəhərləndi, çarqatının ucu ilə gözlərini sildi.* P.Makulu.

**QƏHƏRLİ** *sif.* Acıqlı, qəzəbli, hiddətli. *Üfüq qəhərli bir ürək kimi sökülür, dalğalar hücum edən ordular kimi şəfəqlərə tökülür, kainat oyanırdı.* Mir Cəlal.

**QƏHƏT** *is.* [*ər.*] Qıtlıq, yoxluq; quraqlıqdan məhsulatın və s.-nin yetişməməsi, azlığı, tapılmaması. ☐ **Qəhət olmaq, qəhətə çıxmaq** – tapılmamaq, yoxa çıxmaq.

◊ **Başına (başıma) iş (sənət** və s.**) qəhətdir? (qəhət idi?)** – lazımsız, yersiz iş görən adama deyilir, yaxud öz işindən narazılığı ifadə edir. [Hacı Qara:] *Sizin təqsiriniz nə yerə sığışır, nə göyə, .. başınıza sənət qəhət olubdur?* M.F.Axundzadə. [Mirzə Cavad:] *A məlun, .. məgər başına iş qəhətdir?* Ə.Haqverdiyev.

**QƏHƏTLƏŞMƏ** "Qəhətləşmək"dən *f.is.*

**QƏHƏTLƏŞMƏK** *f.* Qıtlaşmaq, tapılmamaq, yoxa çıxmaq.

**QƏHƏTLİK** *is.* Qıtlıq, məhsulsuzluq; quraqlıq nəticəsində məhsul bitməməsi üzündən törəyən aclıq. *Təbrizdə bu saat qəhətlikdir və əhali çörək üzünə həsrətdir.* C.Məmmədquluzadə. // Bir şeyin tapılmaması, azlığı, çatışmaması; ehtiyac.

**QƏH-QƏH** b a x **qəhqəhə**. ☐ **Qəh-qəh çəkmək** – b a x **qəhqəhə çəkmək**. *Naçalnik Qurbanəli bəyə baxıb, qəh-qəh çəkib dedi.* C.Məmmədquluzadə. *Qoca keşikçi qəh-qəh çəkib güldü.* M.Hüseyn.

**QƏHQƏHƏ** *is.* [*ər.*] Bərkdən gülüş, səslə gülmə. *Bu sözə qarşı oturan sərxoşlardan qeyri-təbii qəhqəhələr eşidildi.* M.S.Ordubadi. *Ayrım qızının belə öyünməsindən, Kərim babanın elə sükut ilə büzülüb durmasından bir qəhqəhə qopdu.* A.Şaiq. *Ancaq qızı qəhqəhə ilə güləndə Mirzə Hüseyn gülümsünərək ayağa qalxdı.* S.Rəhman. ☐ **Qəhqəhə çəkmək** – qəhqəhə ilə gülmək; bərkdən, səslə gülmək. *Tamam qorxunc bir qəhqəhə çəkərək, ildırım kimi çaya tərəf qaçır.* S.S.Axundov. *Sitarə ata-anasını görcək, qəhqəhə çəkib .. deyirdi: – Bilmirsiniz? Nişanlıma gül yığmağa getmişdim.* Çəmənzəminli.

**QƏHMƏR** b a x **qahmar**. [Qarı:] *Bala, o, xozeyinlər, naçalniklər üçün qorxulu adamdır. Sənin kimi, mənim kimi fağırların onun kimi qəhmər çıxanı olmasaydı, indi bizim gözümüzə od salmışdılar.* S.S.Axundov. *Yeni dünya quran bizik; Haqqa qəhmər duran*

*bizik*. R.Rza. *Gizlədərəm hissimi, əlaqəmi birtəhər; Deyərəm yaxşı olmaz, çıxsam oğlana qəhmər.* M.Rahim.

**QƏHR** *is.* [*ər.*] Hiddət, qəzəb, acıq. *Çeşmində qəzəb yoxsa dili-zarım üçündür; Qəhri o təbibin dili-bimarım üçündür.* S.Ə.Şirvani. *Kuyində məhrəm etdi rəqibi səfa ilə; Qəhr ilə etmədi məni həm yad, ağlaram*. X.Natəvan. *Qəhr* [Mirzə Hüseyni] *boğdu, cibindən qırağı haşiyəli bir yaylıq çıxarıb gözlərini sildi*. S.Rəhimov.

2. Bir məhrumiyyət, haqsızlıq və s. üzündən doğan hədsiz ruhi əzab və iztirab. *Firqətin qəhri bəni yaqdı və incitdi, əzizim!* Nəsimi. *On bir aydır mənim üzüm gülmədi; Qəza qəhri məndən heç üzülmədi*. Aşıq Ələsgər.

◊ **Qəhr etmək** – 1) məhv etmək, yox etmək. *Xalq bugünkü və sabahkı düşmənlərini qəhr edə bilməzsə, öz taleyini həll edə bilməz.* S.Rəhimov; 2) cəbr etmək, zülm etmək; cəzalandırmaq, iztirab vermək. *Necə qəhr eyləyəsən, aşiqinə rəhm eylə; Ki, sənin rəhmətinə aşiqi-heyran susadı.* Nəsimi. **Qəhr olmaq** – məhv olmaq, yox olmaq. **Qəhr olsun!** – məhv olsun! yox olsun!

**QƏHRƏMAN** [*fars.*] 1. *sif.* Müharibədə, yaxud başqa bir işdə qoçaqlıq, fədakarlıq nümunəsi göstərən; igid. *Qəhrəman ordu. Qəhrəman əsgər*. // İs. mənasında. *Azərbaycanın milli qəhrəmanları. – Seyr edin zamanın qəhrəmanını; Əynində şinel var, çiynində tüfəng.* S.Vurğun. *Bu gün alqış demək qəhrəmanlara; Dünyada hər şeydən mənə şirindir*. O.Sarıvəlli. // *sif.* Qoçaq, cəsur, qorxmaz. [Ceyran] *cəsur, mətin, qəhrəman bir qadın idi.* S.Hüseyn.

2. *is.* Öz dövrünün ictimai mühitinin səciyyəvi xüsusiyyətlərini özündə təcəssüm etdirən şəxs. *Zəmanəmizin qəhrəmanı*.

3. *is*. Ədəbi əsərdə iştirak edən şəxslərin ən birincisi, başlıcası. *Romanın qəhrəmanı. Pyesin qəhrəmanı*.

**QƏHRƏMANANƏ** [*fars*.] b a x **qəhrəmancasına**. *Şəfiqə qəhrəmanənə ətrafa baxırdı*. İ.Musabəyov.

**QƏHRƏMANCASINA** *zərf* Qəhrəmana, igidə yaraşan bir tərzdə; qoçaqlıqla, rəşadətlə; igidcəsinə. *Qəhrəmancasına döyüşmək. Qəhrəmancasına hərəkət etmək*.

**QƏHRƏMANİ** *is. mus*. Azərbaycan xalq oyun havalarından birinin adı. *Yallı musiqisinin forması və ölçüsü əsasında inkişaf edərək meydana gələn Azərbaycan rəqslərindən birisi də* "*Qəhrəmani*" *və* "*Pəhləvani*" *oyun havalarıdır.* Ə.Bədəlbəyli.

**QƏHRƏMANLAŞMAQ** *f.* Qoçaqlaşmaq, qəhrəman olmaq.

**QƏHRƏMANLIQ** *is.* İgidlik, müstəsna qoçaqlıq, rəşadət, cəsurluq; qəhrəmanca hərəkət. *Qəhrəmanlıq dastanı. Antik cəmiyyətin* "*qəhrəmanlıq dövrü*". *Qəhrəmanlıq göstərmək. – Qəhrəmanlıq yalnız silah deyil, bilik də tələb edir.* M.S.Ordubadi. *Əşrəf həyatında hələ heç bir qəhrəmanlıq eləməmişdi.* S.Rəhman.

**QƏHRLƏNMƏK** b a x **qəhərlənmək**.

**QƏHVƏ** *is.* [*ər.*] 1. Tropik ölkələrdə bitən qəhvə ağacının girdə ətirli dənləri. *Qovrulmuş qəhvə. Üyüdülmüş qəhvə.*

2. Bu dənənin ovuntusundan hazırlanan içki. *Qəhvə içmək. Qəhvə bişirmək. Qara qəhvə. Südlü qəhvə.* – [Əbdül:] *Yorulmuşdum, döndüm çayxanaya ki, bir-iki fincan qəhvə içim*. Ə.Haqverdiyev. // Qəhvə surroqatı. *Arpa qəhvəsi. Palıd qəhvəsi*. *Soya qəhvəsi*.

◊ **Qəhvə dəyirmanı** – b a x **dəyirman**.

**QƏHVƏALTI** *is.* Günorta yeməyindən bir neçə saat qabaq yeyilən yemək və ya içilən qəhvə, çay və s. *Küncdəki stol başında üç kişi oturub qəhvəaltı edirdi*. A.Şaiq. *Abakərin arvadı böyük məcməyidə qəhvəaltı gətir*(*di*).. Ə.Əbülhəsən.

**QƏHVƏÇİ** *is.* 1. Qəhvəxana; qəhvə satılan yer. // Sif. mənasında. *Yetdi bir mərtəbəyə surəti-kar;* "*Parlaman*" *qəhvəçi dükan oldu*. M.Ə.Sabir.

2. Qəhvə hazırlayıb satan adam.

**QƏHVƏÇİLİK** *is.* Qəhvəçinin işi, peşəsi.

**QƏHVƏDAN** *is.* [*ər.* qəhvə və *fars*. ...dan] İçində qəhvə dəmləmək üçün qab. *Qəhvədandan stəkanlara qəhvə tökmək.*

**QƏHVƏXANA** *is.* [*ər.* qəhvə və *fars*. ...xanə] Qəhvə içilən yer, kiçik yeməkxana. *Xudayar bəy oğlanın dalınca dar yol ilə gedib girdi qəhvəxanaya.* C.Məmmədquluzadə.

**QƏHVƏYİ** *sif.* Qəhvə rəngli, boz ilə sarı arasında olan rəng. *Qəhvəyi parça*. – [Rəis] *tünd qəhvəyi rəngli yun parçadan frenç və*

*şalvar geymişdi.* İ.Əfəndiyev. *Fələk qəhvəyi suda əks etməz, bu bəllidir...* Şəhriyar.

**QƏLB** *is.* [*ər.*] 1. Ürək (adətən insanın daxili aləmi, onun hisslərinin, təəssüratının, əhvali-ruhiyyəsinin simvolu, rəmzi təzahürü mənasında işlənir). *Bu təsadüf onun qəlbində bir etimad oyandırdı.* M.Ə.Sabir. *Haman qız bütün səyahətçilərin qəlbini özünə məftun etmişdi.* M.S.Ordubadi. *Xavər yenə qəlbində sonsuz bir rahatçılıq və səadət duydu.* M.İbrahimov. // *məc.* İnsanın həyat məqsədi, idealı, onu yaşatdıran amil mənasında. [Hüseyn:] *..Səhnə mənim məqsədim, idealım və qəlbimdir.* S.Rəhman.

2. *məc.* Bir şeyin əsas hissəsi, ən mühüm yeri, mərkəzi. *Bakı Azərbaycanın qəlbidir.*

◊ **Qəlb yoldaşı** – sirdaş, ürək dostu, səmimi dost. *Ancaq həyalı bir qız mənə qəlb yoldaşı ola bilər.* Mir Cəlal. **Qəlbi incimək** – incimək, xatiri qırılmaq. *Demək bu halizarı ol güli-rüxsarə müşküldür; Məbada inciyə qəlbi, bu dərdə çarə müşküldür.* S.Ə.Şirvani. *Qoy bədənim rahət olsun, amma qəlbim inciməsin.* C.Məmmədquluzadə. **Qəlbi sevinmək** – şadlanmaq, fərəhlənmək, sevinmək. *Məni görər-görməz sevindi qəlbi; Dedi ki, atana məndən salam de.* S.Vurğun. **Qəlbi sıxılmaq** – ürəyi sıxılmaq, darıxmaq. *Əgər istəyirsən ki, uşağın qəlbi sıxılmasın, onu çağır bura və xoş dil ilə onu danışdır.* C.Məmmədquluzadə. **Qəlbi sınmaq** – b a x **qəlbi incimək**. *Qəlbin sınmasın, nigaran da qalma.* M.S.Ordubadi. **Qəlbi vurmaq** – ürəyi işləmək, sağ olmaq, yaşamaq, var olmaq. *Bir səs duydum qələm əldən düşüncə: – Mənim üçün qəlbin vursun ölüncə..* Ə.Cavad. **Qəlbi yanmaq** – ürəyi yanmaq, son dərəcə yazığı gəlmək, acımaq. *Qəlbim yanar, ona deyərəm:* "*Ay yazıq çocuq! Sən sevgili vətəncigimin gül fidanısan*". A.Səhhət. **Qəlbi yaralı** – dərdli, kədərli, ürəyində dərdi olan, fəlakət üz vermiş. *Ey qəlbi yaralı, fikri pərişan; Qəlbindən keçəni qorxma, de gəlsin.* B.Vahabzadə. **Qəlbindən keçmək** – ürəyindən keçmək, ummaq. *Salatın bu hadisədən sonra anasının qəlbindən keçənləri bilməsə də, onun sakitləşməsinə sevindi.* İ.Şıxlı. **Qəlbinə dəymək** – 1) incimək, pərt olmaq, qəlbi sınmaq; 2) incitmək, ürəyinə toxunmaq, könlünü qırmaq. *Biganə ilə gəzmə, dedim, qəlbinə dəydi; Cana, nə bilim, sən bu qədər dəymədüşərsən?* Ə.Vahid; *Sallanıb-sallanıb özünü öymə; Elə süzgün baxıb qəlbimə dəymə.* Aşıq Ələsgər. **Qəlbinə girmək** – birinin ürək sirrini bilməyə çalışmaq. **Qəlbinə toxunmaq** – b a x **qəlbinə dəymək** 2-ci mənada. *Toxunma qəlbinə avarə gülün..* X.Natəvan. **Qəlbini açmaq** – birinə inanaraq ürəyini açmaq, ürəyindəkiləri açıb söyləmək, ürək sirrini açıb demək. *O zaman qəlbini bizə el açar; Öz ürək sözünü deyər doyunca.* S.Vurğun. **Qəlbini ələ almaq** – könlünü almaq, xoş sözlərlə dilə tutmaq, şirin sözlərlə razı etməyə, etimadını, məhəbbətini qazanmağa çalışmaq. [Gəldiyev] *axırda qızı mehriban danışdırmağı və beləliklə, bəlkə qəlbini ələ almağı kəsdirdi.* Mir Cəlal. **Qəlbini qırmaq (incitmək)** – b a x **qəlbinə dəymək** 2-ci mənada. **Qəlbini ovlamaq** – ələ gətirmək, diqqətini cəlb etmək, məhəbbətini qazanmaq, özünə məftun etmək. *Operanın açılışı gecəsi istəklilər lojada əyləşdikləri zaman, Hədiyyə qət etmişdi ki, Kiçikxanım Nərimanın qəlbini ovlamışdır.* Mir Cəlal. **Qəlbini sıxmaq** – ürəyini sıxmaq, darıxmaq, qəm çəkmək, fikir çəkmək. *Babalın boynuma, get fələlik et, qəlbini sıxma!* M.Ə.Sabir. [Mir Paşa:] *Əziz gedib deyə, çox da darıxma; Fikirlər eyləyib qəlbini sıxma.* Z.Xəlil. **Qəlbini sındırmaq** – b a x **qəlbinə dəymək** 2-ci mənada. [Nizami] *Fəxrəddin barəsində düşünür və onun qəlbini sındırdığı üçün peşmançılıq çəkirdi.* M.S.Ordubadi.

**QƏLBAÇAN** *sif.* Ürəkaçan, xoş, gözəl. *Öz-özünə aşıq deyən hər kəsdə; Qəlbaçan səs, şirin söhbət gərəkdir.* Aşıq Bəylər.

**QƏLBƏN** *zərf* [*ər.*] Can və könüldən, ürəkdən, səmimi olaraq. *Qəlbən bağlı olmaq. Qəlbən sevmək. Qəlbən sizə hörmətim var. – Vətən həsrətiylə külə dönmüşəm; Qəlbən ağlasam da, şad görünmüşəm.* B.Vahabzadə.

**QƏLBİ** *sif. məh.* Yüksək, hündür, uca. *Qazamat istidir, yata bilmirəm; Barısı qəlbidir, aşa bilmirəm.* "Qaçaq Nəbi". [Qəhrəman] *ötən qış çovğunda qəlbi bir ağacdan yıxılıbdır.* S.Rəhimov. *Uzaqlarda görünən*

*qəlbi dağların üzərindəki buludların min rəngə boyandığı zaman Sərvinaz .. tarlanın qırağına çıxdı*. Ə.Vəliyev. // *İs. mənasında*. Hündür yer. *..Xanımlar əllərində uzun ağac, ucunda ağ dəsmal, duracaqlar qəlbidə*. N.Vəzirov.

**QƏLBİDAŞ** *sif.* Daşürəkli, rəhmsiz, insafsız. *Çalış ki, bir güllən çıxmasın boşa; Dəysin o faşistə, o qəlbidaşa*. S.Rüstəm.

**QƏLBİQARA** *sif.* və *is.* Hər şeyə, hər kəsə şübhə ilə baxan, heç kəsin xoşbəxtliyini istəməyən, hər şeydə bir pislik görən; xain ürəkli. *Hər qəlbiqara nakəs ilə eyləmə ülfət*. S.Ə.Şirvani.

**QƏLBİQARALIQ** *is.* Qəlbiqara adamın keyfiyyəti.

**QƏLBİQIRIQ** *sif.* İncimiş, küskün, ürəyi bir şeydən sınmış.

**QƏLBİLƏNMƏ** "Qəlbilənmək"dən *f.is.*

**QƏLBİLƏNMƏK** *f. məh.* Yüksəlmək, ucalmaq, yuxarı qalxmaq, yüksəklərə qalxmaq. *Mən aşiq qəlbiləndi; Ay doğdu qəlbiləndi; Nəyə desən and içim; Bu qəlb o qəlb iləndi.* (Bayatı).

**QƏLBİLƏŞDİRMƏ** "Qəlbiləşdirmək"dən *f.is.*

**QƏLBİLƏŞDİRMƏK** *f. məh.* Yüksəltmək, ucaltmaq, yuxarı qaldırmaq.

**QƏLBİLƏŞMƏK** b a x **qəlbilənmək**.

**QƏLBİLƏTMƏK** *f. məh.* Yüksəltmək, hündürləşdirmək. *Baş altını qəlbilətmək*.

**QƏLBİNAZİK** *sif.* Ürəyiyumşaq, rəhmli, şəfqətli, hər şeydən tez təsirlənən. *Qəlbinazik adam. – Özün çox qəlbinaziksən, hamını da elə bilirsən*. M.S.Ordubadi.

**QƏLBİNAZİKLİK** *is.* Ürəyi yumşaqlıq, şəfqətlilik, şəfqət.

**QƏLBİR, QƏLBİRLƏMƏ** və s. b a x **xəlbir, xəlbirləmə** və s.

**QƏLBİSINIQ** b a x **qəlbiqırıq**.

**QƏLƏ** [*ər.*] b a x **qala**.

**QƏLƏBƏ** *is.* [*ər.*] 1. Qalibiyyət; müharibədə, döyüşdə tam müvəffəqiyyət. *Qələbə bayramı. Düşmən üzərində qələbə. Qələbə ilə qayıtmaq.*

2. Bir şey uğrunda mübarizədə əldə edilən müvəffəqiyyət, mübarizə nəticəsində bir şeyin tam həyata keçirilməsi. *Tam və qəti qələbə. İstehsalat qələbələri. – Qələbə bayrağı qaldırıb yenə; Əmək cəbhəsinin qəhrəmanları*. O.Sarıvəlli. // Yarışda, oyunda, mübahisədə və s.-də üstünlük, böyük nailiyyət, müvəffəqiyyət. *Futbol oyunu neftçilərin qələbəsi ilə nəticələndi*. ☐ **Qələbə qazanmaq (əldə etmək, çalmaq)** – qalib gəlmək, üstün gəlmək. [Dilarada] *ədalətin, haqqın qələbə çalacağına möhkəm bir etiqad vardı*. M.İbrahimov.

3. "**Qələbəsindən**" şəklində *köhn.* – üstünlüyündən, çoxluğundan, artıqlığından, şiddətindən, çox olmasından, təsirindən. *Münəvvər məcburiyyətin qələbəsindən bozarmış anasının qabağına düşüb getməyi ixtiyar etmişdi.* M.S.Ordubadi.

**QƏLƏBƏLİK** *is.* İzdiham, tünlük, basabas; çoxlu adam olan yer. *Əhmədli kəndinin meydançası çox qələbəlik idi.* H.Nəzərli. *Böyük qələbəlik içində Rüxsarə onların hər ikisini gözdən itirir*. S.Rəhimov. // Sif. mənasında. *Bu, Bakının mərkəzi küçələrinin ən qələbəlik və gur saatlarından biri idi.* Ə.Əbülhəsən.

**QƏLƏBƏND** [*ər.* qələ və *fars.* ...bənd] b a x **qalabənd**.

**QƏLƏBƏNDLİK** b a x **qalabəndlik**.

**QƏLƏBƏYİ** b a x **qalabəyi**.

**QƏLƏÇƏ** *is.* [*ər.* qələ və *fars.* ...çə] Kiçik qala, qalaça. *Bu qələçələri təmir etməkdən qərəz bu idi ki, tayifeyi-Xəzər Dərbəndə qələbə və təsəllüt edə bilməsinlər.* "Dərbəndnamə".

**QƏLƏM** *is.* [*ər.*] 1. Mürəkkəbə batırıb yazmaq üçün ucu şiş və yarıq yazma aləti. *Dəmir qələm. Qələmi əlinə alıb yazdı. – Qələm yazanı qılınc poza bilməz.* (Ata. sözü). [Sədr] *siyirməsindən bloknot çıxardı, bir neçə vərəq geri qatladı, qələmi mürəkkəbə batırıb yazmaq istədi.* Mir Cəlal. // Polad qələmlər ixtira edilməmişdən qabaq qamışdan, qaz ləleyindən hazırlanan yazı aləti. *Qələm əyri kəsilsə də, doğru yazar*. (Ata. sözü). *Bir baş çəkin dərdməndin halına; Ərzə yazsın, qələm alsın əlinə.* M.V.Vidadi. *Baxır kəlağaylı keçən gəlinə; Qarğı qələmini alır əlinə*. S.Vurğun. // Karandaş. *Salman kişi ona* [Aqilə] *çoxlu dəftər, rəngli qələm alacağını vəd etdi.* Mir Cəlal.

2. *məc.* Yazma qabiliyyəti, inşa qabiliyyəti, üslub; yazı. *Onun gözəl qələmi vardır.*

– *Süngülər açmayan yolu açdın; Qələmindən cavahirat saçdın.* A.Səhhət. *Diləyim budur ki, hər gecə, hər gün; Sənin qələmindən inci tökülsün.* S.Vurğun. // Yazıçılıq simvolu kimi işlənir. *Qələm möhkəm olmasa, yazının gücü olmaz.* Mir Cəlal. *Ürəksən, olmuşdur əsirin aləm; Nə yazsın, hüsnünə zəif bir qələm?* S.Vurğun. ☐ **Qələm əhli** – bax **qələm sahibi**. *Vaiz, qələm əhlin niyə təhqir eləyirsən? Ey əbri-siyəh, nuri nə təstir eləyirsən!* M.Ə.Sabir. *O qələm əhliydi, dilli-dilavər; Mən elə bilirdim ər oğlu ərdi.* X.Rza. **Qələm sahibi** – fikrini yazıda yaxşı ifadə edə bilən adam; yaxşı üslubu, mühərrirlik qabiliyyəti olan adam; yazıçı, mühərrir. **Qələm yoldaşı** – birisi ilə bir yerdə yazı işində çalışan, yazıçılıq, mühərrirlik edən; həmkar. *Məgər, otuz yeddidə güdaza vermədimi; Qələm yoldaşlarını; öz qələm yoldaşları?* B.Vahabzadə.

3. Metal, daş, taxta və s. kimi bərk cisimlərin üzərində yazı yazmaq, naxış açmaq və s. üçün poladdan düzəldilmiş ucu iti alət. *Yazıçı qələmi. Heykəltəraş qələmi. Möhürqazan qələm.* // Dəmir kəsmək üçün ağzı iti polad alət. // *məh.* Odun yarmaq, daş sındırmaq və s. üçün dəmir alət.

4. *k.t.* Peyvənd üçün qələm kimi kəsilmiş nazik şiv. *Qələm vurmaq. Peyvənd qələmi* (ağaca calanacaq budaq parçası). *Calaq üçün götürülən bitkinin calandığı bitki calaq və ya qələm adlanır. – Qələmlə ən çox limon və sitrus bitkiləri çoxaldılır, çünki bunların qələmlərinin çox faizi kök vermək qabiliyyətinə malikdir.* M.Axundov. ☐ **Qələm etmək (eləmək)** – 1) *k.t.* peyvənd etmək, calamaq; 2) ucunu qələm kimi kəsmək, sivriləşdirmək. [Qaraxan] .. *dəmir kimi qurumuş çəpərdən bir neçə şiv çəkdi, onların ucunu yonub qələm elədi və qırıntılarını da su aşağı axıtdı.* S.Rəhimov. **Qələm olmaq** – peyvənd olmaq, calanmaq, cinsi yaxşılaşdırmaq. *Qələm olmuş cır alma.* // Ot, taxıl çalındıqdan sonra, onların yerdə qalan ucuşiş kök hissəsi. *Ayağıma qələm batdı.* // Cavan ağac, fidan. *Qələm basdırmaq.*

5. *köhn.* Cür, növ. *Beş qələm şey. – Mahmudun sərvəti yalnız bu dükan və dükanda mövcud olan maldan ibarət olmayıb, bunlardan başqa iki qələm malı daha vardı.* B.Talıblı.

6. Lələk (quşlarda). *Xoruzun boynunda, belində, qanadlarının və quyruğunun üstdə uzun, əyri və rəngbərəng qələmlər var..* H.Zərdabi.

◊ **Qələm çalmaq** – yazmaq, yazıb tərifləmək. *Yüz il qələm çalsam gözəl hüsnünə; Doyarmı eşqindən sadiq bir ürək?* S.Vurğun. *Məndə qüdrət yoxdur qələm çalmağa; Tərif eyləməyə ancaq birini.* Ə.Cavad. **Qələm çəkmək** – pozmaq, adını silmək, yaddan çıxarmaq, adını çəkməmək. *Qələm çəkdi əsarətə, əbədilik o şad oldu.* M.Rahim. **Qələm işlətmək** – yazmaq. *Salik, mərsiyə şerinin geniş yayıldığı zamanda yaşamasına baxmayaraq, bu sahədə demək olar ki, qələm işlətməmişdir.* (Qəzetlərdən). **Qələm qaş** *şair.* – sanki qələmlə çəkilmiş incə, gözəl qara qaş. *Ələsgərəm, yandım eşq atəşində; Gözüm qaldı sənin qələm qaşında.* Aşıq Ələsgər. *İlhamın zövq alır can sirdaşından; Sular sonasının qələm qaşından.* S.Vurğun. **Qələm qatmaq** – yazılan bir yazıya təshih və ya təhrif məqsədi ilə əlavələr etmək, pozub düzəltmək, üzərində işləmək. **Qələm olmaq** – sınmaq, kəsilmək. *Qələm olsun əli ol katibi-bədtəhririn; Ki, fəsadi rəqəmi surumuzu şur eylər.* Füzuli. *Bir yanda qələm oldu uzun qollari-Abbas; Bir yanda gərək xeymələr odlana bu gündə.* Aşıq Ələsgər. **Qələmdən düşmək** – yaddan çıxmaq, adı çəkilməmək, yada salınmamaq, sayılmamaq. **Qələmə alınmaq** – yazılmaq, inşa edilmək, təsvir edilmək. *Rusca qələmə alınmış yazıları layiqincə oxuya bilmirəmsə də, çap olunan kitabları bir əndazəyə qədər oxuram.* M.Ə.Sabir. *Leyli və Məcnun, Romeo və Cülyetta .. kimi gənclərin faciəsi böyük sənətkarlıqla qələmə alınmış və bu faciə əsrlər boyu insanları həyəcanlandırmışdır.* M.Arif. **Qələmə almaq** – bir mövzu ətrafında bir şey yazmaq, inşa etmək, yazmağa başlamaq, təsvir etmək. *Qaragözov işığı yan edib, alətləri yerə qoyanda nə qədər sevindiyimi qələmə ala bilmirəm.* Mir Cəlal. **Qələmə vermək** – bir adamın adını yaxşılıq, yaxud yamanlıq ilə birinin yanında çəkmək və ona tanıtmaq. *Sənin adını pis qələmə veriblər. O, yaxşı*

*qələmə verilmişdir.* – [Hacı Murad:] *Orada evim yıxılıbdır ki, xalq məni dövlətli qələminə veribdir.* S.S.Axundov. **Qələmindən çıxmaq** – tərəfindən yazılmaq, inşa edilmək. *Sənətkarların qələmindən çıxmış ölməz əsərlər. – Hər dəfə ağamın qələmindən çıxan həcvlərdə o qədər zəhər olur ki, cəhənnəmdə, onun hücrələrində bu qədər zəhər yoxdur*. Ə.Məmmədxanlı.

**QƏLƏMCİK** *is.* Kiçik qələm.

**QƏLƏMDAN** *is.* [*ər*. qələm və *fars*. ...dan] Qələmqabı, qələm qoymaq üçün uzunsov qutu. *Məşədi Molla Həsən əvvəl eynəyi taxır gözünə, sonra qələmdanı açır.* C.Məmmədquluzadə. [Əhməd:] *Sən elə yüz ildir gözünü bir qələmdan ilə bu kitaba dikibsən.* Ə.Haqverdiyev. *Molla Fərzəli qələmi qələmdana qoydu..* A.Şaiq.

**QƏLƏMDAŞ** *is.* 1. Karandaş.

2. Qara lövhə üzərində ağ yazı yazmağa məxsus nazik çubuq şəklində azca yumşaq mədəni maddə; qrifel.

**QƏLƏM-DAVAT** *is.* [*ər.*] *köhn.* Qələm ilə mürəkkəb qabı birgə olan yazı cihazı. *Qələm-davatını götürüb .. düşdü Koroğlunun yanına.* "Koroğlu".

**QƏLƏMƏ** *is. bot*. Düz uzanıb qalxan uca ağac. *Şıdırğı yaz yağışından sonra qarağac, qələmə, şam ağaclıqları sükuta qərq olmuşdu*. Mir Cəlal.

**QƏLƏMƏLİK** *is.* Qələmə ağacları bitmiş yer.

**QƏLƏMİ** *sif.* [*fars*.] Narıngüllü Buxara dərisindən tikilmiş. [Zərgər Hacı Məmmədin] *qara rəngə boyanmış top qara saqqalı, başında Buxara dərisindən qələmi papağı var idi.* H.Sarabski.

**QƏLƏMKAR** *is.* [*ər*. qələm və *fars*. ...kar] 1. Parça və s. üzərində incə naxışlar çəkən usta, nəqqaş.

2. Qıraqları haşiyəli və ortası güllü parça. *Süfrə İsfahanda qayrılmış "qələmkar" adlı güllü bir parçadandı.* M.S.Ordubadi. *Əvvəlləri İrana səfər edərək, çit, qələmkar və qədək alıb satırdı*. A.Şaiq. // *sif.* Qıraqları haşiyəli və ortası güllü. *Otaqları tərtəmiz süpürtmüş, sildirmiş, lazım olan .. bəzəyi vermiş, masa üzərində incə naxışlı qələmkar süfrə sərmişdi.* A.Şaiq. *Bu əsnada qələmkar pərdəli qapı açıldı*. Çəmənzəminli. *Bayram axşamının gecəsi bütün ailə evə toplanardı. Qələmkar süfrə ortalığa döşənərdi*. H.Sarabski. // *məc. şair*. Qələm kimi düz və incə. *Günəşüzlü, aycamallı; Qəddi qələmkar necoldu?* Aşıq Hüseyn Cavan.

**QƏLƏMKARLIQ** *is.* Qələmkar peşəsi.

**QƏLƏMQABI** *is.* Qələm qoymaq üçün qab; qələmdan. *Bu stolun üstündə cürbəcür qələm, qələmqabı, mürəkkəbqabı, mərmər suçəkən, zəng və bu kimi şeylər vardı.* Ə.Əbülhəsən.

**QƏLƏMQAŞ(LI)** *sif.* Qaşları sanki qələmlə çəkilmiş, nazik, gözəl qara qaşlı. *Qələmqaşlı, xumargözlü bu dilbər; Dinməsə də, ürəyində sözü var.* S.Vurğun. *Yetişdi sipahi-qızılbaş, xanım! Halal et məni, ey qələmqaş xanım!* M.Möcüz. *Mənim yarım gərək qələmqaş olsun*. M.Rahim.

**QƏLƏMLƏMƏ** "Qələmləmək"dən *f.is.*

**QƏLƏMLƏMƏK** *f.* 1. *k.t.* Qələm eləmək, peyvənd etmək (ağacı), cins və yaxşı meyvə verən ağacdan calaq vurmaq.

2. Ağacın qurumuş qol-budağını kəsmək.

**QƏLƏMLƏNMƏK** *məch. k.t.* Qələm edilmək, peyvənd edilmək. *Bu ağacların hamısı qələmlənmişdir.*

**QƏLƏMLƏNMİŞ** *f.sif.* 1. *k.t.* Peyvənd edilmiş, qələm edilmiş (ağac).

2. Qol-budağı vurulmuş (ağac).

**QƏLƏMLƏTMƏ** "Qələmlətmək"dən *f.is.*

**QƏLƏMLƏTMƏK** *icb. k.t.* Qələm etdirmək, peyvənd etdirmək.

**QƏLƏMLİK** *is.* Cavan ağaclar əkilmiş yer, qələm basdırılmış yer; fidanlıq.

**QƏLƏMTƏRAŞ** *is.* [*ər*. qələm və *fars*. ...təraş] Qələm çərtmək üçün bıçaq və s.

**QƏLƏMUCU** 1. *is.* Qələmin yazan uc hissəsi; pero.

2. *zərf dan.* Tez, tələsik, müxtəsər.

**QƏLƏNDƏR** *is.* [*fars*.] Şərqdə: dünyadan əl çəkib, sərsəri həyat keçirən dərviş; dünyanın zövq və nemətlərinə inanmayaraq, həqiqət axtaran filosof. *Həm bən qələndər surətəm, fərdəm, mücərrəd təcridəm; Gərçi fəqirəm, həm gəda, mülkə Süleyman gəlmişəm*. Nəsimi. // Ümumiyyətlə, sərsəri, divanə. *Gördüm camalını, oldum qələndər; Laçın tək qıya bax, üz bəri döndər.* Aşıq Dilqəm. // Çoxbilmiş mənasında.

◊ **Qələndər-a-qələndər** – uşaq oyunlarından birinin adı.

**QƏLƏNDƏRANƏ** *sif.* və *zərf* [*fars.*] Qələndər kimi, qələndərcəsinə. *Qələndəranə həyat*.

**QƏLƏNDƏRLİK** *is.* Qələndər həyatı, sərsərilik. *Qələndərlik etmək*.

**QƏLƏT** *is.* [*ər.*] Səhv, yanlış, xata, yanılma. *Qələt söyləmək. Qələt yazmaq. – A qardaş, bircə qulaq as, gör nə deyirəm, sən qaçaqlığı lap qələt anlayırsan.* M.F.Axundzadə. *Xub, günahımızdan keç, bir qələtdi elədik, bundan sonra təklifimizi bilərik.* C.Məmmədquluzadə. [Turac:] *Mənim qələtim çıxmadı?* C.Cabbarlı. ☐ **Qələt eləmə!** *dan.* – xəbərdarlıq, hədə, saqındırma bildirir. *Dadaşım ikiəlli yapışardı qulaqlarımdan, qovzardı göyə .. və deyərdi: "Di get, bir də belə qələt eləmə!"* C.Məmmədquluzadə. **Qələt eləmək** *dan.* – tövbə etmək, bir daha etməyəcəyinə söz vermək. [Tarverdi:] *Vay, aman, qələt elərəm, quldurluğa dəxi çıxmanam, heç kimi soymanam, tövbə olsun, tövbə, tövbə!* M.F.Axundzadə. **Nə qələt eləyirsən?** *dan.* – sənin nə ixtiyarın var, sənin heç bir sözün ola bilməz, sən nəçisən. [Həmzə:] *Vaxta ki, mən və anan razıyıq, sən* [Səriyyə] *nə qələt eləyirsən?* C.Cabbarlı.

**QƏLƏTSİZ** *sif.* və *zərf* Düzgün, səhvsiz. *Qələtsiz yazı. Qələtsiz yazmaq. Qələtsiz tələffüz etmək*.

**QƏLƏVİ** *is.* [*ər.*] *kim*. Duzun turşu ilə birləşməsi nəticəsində əmələ gələn, suda əriyən kimyəvi maddə. *Məhlula müəyyən qatılıqda qələvi .. əlavə etdikdə, onun dayanıqlığı artır*. Quliyev. // Sif. mənasında. *Qələvi reaksiya.*

**QƏLƏVİLƏŞDİRİLMƏ** "Qələviləşdirilmək"dən *f.is.*

**QƏLƏVİLƏŞDİRİLMƏK** *məch. kim*. Qələvi halına salınmaq, qələvi hopdurulmaq, qələvi əlavə edilmək.

**QƏLƏVİLƏŞDİRMƏ** *kim*. "Qələviləşdirmək"dən *f.is.*

**QƏLƏVİLƏŞDİRMƏK** *f. kim*. Qələvi halına salmaq, qələvi hopdurmaq, qələvi əlavə etmək.

**QƏLƏVİLİ** *sif. kim*. Tərkibində qələvi olan.

**QƏLƏVİLİK** *is. kim*. Bir maddənin qələvi ilə doyma dərəcəsi.

**QƏLƏYAN** *is.* [*ər.*] Coşma, qaynama, həyəcan; cuşa gəlmə. ☐ **Qələyan etmək, qələyana gəlmək** – coşmaq, qaynamaq, cuşa gəlmək, həyəcana gəlmək. *Müəllimin hissiyyatı birdən qələyana gəldi*. S.Hüseyn.

**QƏLİB** *is.* 1. Bir şeyə bu və ya digər bir şəkil vermək üçün onun içinə keçirilən alət; ülgü. *Papaq qəlibi. Çəkmə qəlibi. Qəlibə çəkmək* (salmaq, vurmaq).

2. Tökmə vasitəsilə müəyyən formalı şeylər hazırlamaq üçün içərisi həmin formaya uyğun şəkildə düzəldilmiş qab, alət (bu qablara ərgin və ya horra halında tökülən maddə soyuduqdan və ya quruduqdan sonra həmin qabın içinin şəklini alır). *Qırma qəlibi. Güllə qəlibi. Hürufat qəlibi. Kərpic qəlibi. Sabun qəlibi*.

3. Qəlibdən çıxmış, qəlib vasitəsilə hazırlanmış şey. *Bir qəlib sabun*.

◊ **Qəlibdən-qəlibə girmək** yaxud **min qəlibə girmək** – öz şəkil və simasını tez-tez dəyişmək, dondan-dona girmək.

**QƏLİBÇİ** *is.* 1. Qəlibdə işləyən işçi (b a x **qəlib** 2-ci mənada).

2. Qəlib qayıran usta.

**QƏLİBLƏMƏ** "Qəlibləmək"dən *f.is.*

**QƏLİBLƏMƏK** *f.* Qəlibə keçirmək, qəlibə salmaq, qəlibə vurmaq.

**QƏLİBLƏNMƏ** "Qəliblənmək"dən *f.is.*

**QƏLİBLƏNMƏK** *məch.* Qəlibə keçirilmək, qəlibə salınmaq, qəlibə vurulmaq.

**QƏLİBLƏTMƏ** "Qəliblətmək"dən *f.is.*

**QƏLİBLƏTMƏK** *icb.* Qəlibə çəkdirmək, qəlibə saldırmaq, qəlibə vurdurmaq.

**QƏLİBLİ** *sif.* Qəlibə vurulmuş, qəlibə çəkilmiş, qəlibə keçirilmiş.

**QƏLİZ** *sif.* [*ər.*] 1. Qatı; duru olmayan. *Qəliz mürəkkəb. – Siz arxayın olun, ağa, mən özüm bu qəliz xörəklərdən seçib bir yaxşı nahar hazır edərəm.* N.Vəzirov. *Dərya suyunun duzu və özü də ağır olduğuna* [görə] *qəliz olur*. H.Zərdabi.

2. Anlaşılması çətin olan, anlaşılmaz, çox mürəkkəb. *Qəliz ibarə. Natiq çox qəliz* (z.) *danışdı*. – [Dursun] *ölmədiyini .. qəliz andlar ilə zor-güc Ballıya inandırdı*. A.Şaiq.

3. Kəsif, sıx. *Bir azdan sonra, uzaqdan qəliz toz dumanlarını .. pozaraq, kiçik bir dəstə göründü*. M.S.Ordubadi. *Elbanın*

*arxasında bütün sahil boyu meşə yanırdı. Oradan gələn qəliz bir tüstü istehkamçıları öz pərdəsi altına alırdı*. Ə.Sadıq.

4. Tünd, kəskin. *..Özü mənə yaxınlaşmadan əvvəl* [ətrin] *qəliz qoxuları məni əhatə etdi*. M.S.Ordubadi.

**QƏLİZLƏNMƏ** "Qəlizlənmək"dən *f.is.*

**QƏLİZLƏNMƏK** b a x **qəlizləşmək**.

**QƏLİZLƏŞDİRİLMƏ** "Qəlizləşdirilmək"dən *f.is.*

**QƏLİZLƏŞDİRİLMƏK** *məch.* Qəliz hala salınmaq, qəliz edilmək.

**QƏLİZLƏŞDİRMƏ** "Qəlizləşdirmək"-dən *f.is.*

**QƏLİZLƏŞDİRMƏK** *f.* Qəliz hala salmaq.

**QƏLİZLƏŞMƏ** "Qəlizləşmək"dən *f.is.*

**QƏLİZLƏŞMƏK** *f.* Qəliz hala düşmək. *Palçıq qalıb qəlizləşdi*.

**QƏLİZLİK** *is.* Qəliz şeyin halı. *Mürəkkəbin qəlizliyi. Tüstünün qəlizliyindən adamın gözü tutulur. – Şəhərin havasının qəlizliyindən, tozundan, zəhmətinin kəsrətindən bir qədər asudələşmək .. üçün kəndə rəvan oldum*. Ə.Haqverdiyev.

**QƏLLAŞ** *is.* [*fars.*] *klas*. Sərsəri, dərbədər, xərəbati; ömrünü meyxanalarda keçirən adam, kefcil. *Rindü qəllaşəm, məqamım guşeyi-meyxanədir*. Nəsimi. *Eşqə dil verdin deyib cövr etmə, ey zahid, mənə; Can verər məşuqə daim aşiqi-qəllaşlər*. Xətayi. // Sif. mənasında. *Bir belə gözələ qurban olmağa; Vaqif kimi qəllaş kimsə gərəkdir*. M.P.Vaqif.

**QƏLLƏ** *is.* [*ər.*] *köhn*. Taxıl, məhsul, arpa-buğda.

**QƏLP** *sif.* 1. Saxta, yalançı, yapma, qayırma. *Qəlp pul. – Gümüşüm tunc oldu, zərü zibam bez; Qəlp çıxır aldığım mal, qoca bəxtim!* Aşıq Ələsgər.

2. Paxıl, qeyri-səmimi, riyakar, yaramaz, pis. *Qəlp adam. – Bu sözləri mən ondan ötrü ərz edirəm ki, dünyada qəlp adam çoxalıbdır*. C.Məmmədquluzadə.

3. Tənbəl, canını işə verməyən. *Bu öküz çox qəlp öküzdür, heç işləmək istəmir*.

**QƏLPƏ** *is.* Bərk bir şeyin qopub parçalanmış hissəsi, parçası. *Daş qəlpəsi. Mərmi qəlpəsi. – ..Bir mina qəlpəsi də* [Kamalın] *bel sümüyünə ilişib qaldı*. M.İbrahimov. [Zülfüqar kişi] *əyilib lap çuxurun yanından mişar kimi dişli uzunsov iri bir qəlpə götürdü*. Ə.Əbülhəsən.

**qəlpə-qəlpə** *zərf* Tikə-tikə, parça-parça. *Həqiqəti əsrlərin qanlı pəncəsindən; Qəlpə-qəlpə qoparan; Bir xalqın hekayəti var*. R.Rza. *Birdən cəhrə sınıb qəlpə-qəlpə olmuşdu*. Ə.Əbülhəsən.

**QƏLPƏLƏMƏ** "Qəlpələmək"dən *f.is.*

**QƏLPƏLƏMƏK** *f.* Bir şeyin kiçik parçasını qoparmaq, qəlpə-qəlpə etmək. *Daşı çəkiclə vurub qəlpələdi*. // Bir şeyə ilişdirib cırmaq, kiçicik parçasını qoparmaq. *Paltarını kola ilişdirib qəlpələdi*.

**QƏLPƏLƏNDİRİLMƏ** "Qəlpələndirilmək"dən *f.is.*

**QƏLPƏLƏNDİRİLMƏK** "Qəlpələndirmək"dən *məch*.

**QƏLPƏLƏNDİRMƏ** "Qəlpələndirmək"-dən *f.is.*

**QƏLPƏLƏNDİRMƏK** b a x **qəlpələmək**.

**QƏLPƏLƏNƏN** *f.sif.* Tez qəlpələrə ayrılan, parçalanan, qəlpə-qəlpə olan, tikələnən. *Qəlpələnən bomba*.

**QƏLPƏLƏNMƏ** "Qəlpələnmək"dən *f.is.*

**QƏLPƏLƏNMƏK** *f.* Bir şeydən kiçik parça qopmaq, yaxud qırılmaq. *Daş qəlpələndi*. // Bir şeyə ilişib bir tikəsi qırılmaq, qopmaq. *Ətəyim mıxa ilişib qəlpələndi*.

**QƏLPƏLƏNMİŞ** *f.sif.* Bir şeyə toxunub, ya ilişib bir parçası qopmuş, cırılmış. *Qəlpələnmiş daş. Qəlpələnmiş köynək*.

**QƏLPƏLƏTMƏK** *f.* Bir şeyi bir şeyə toxundurub, yaxud ilişdirib bir hissəsini və ya parçasını qopartmaq, cırmaq. *Dəmiri çəkiclə vurub qəlpələtmək. Paltarını mıxa ilişdirib qəlpələtmək*.

**QƏLPƏLİ** *sif.* Qəlpəsi olan, qəlpələnmiş.

**QƏLPLİK** *is.* 1. Qəlp şeyin halı; saxtalıq. *Pulun qəlpliyi*.

2. Saxta hal, saxta hərəkət; səmimiyyətsizlik, riyakarlıq, yaramazlıq.

3. Canını işə verməmə; canıyanmazlıq.

**QƏLSƏMƏ** *is.* [*ər.*] *zool.* Su heyvanlarında (balıqlarda, xərçənglərdə, molyusklarda və s.) xarici tənəffüs üzvü. *Balıqlar qəlsəmələri ilə tənəffüs edirlər*.

**QƏLSƏMƏLİ** *sif. zool.* Qəlsəməsi olan, qəlsəmələri ilə tənəffüs edən. *Qəlsəməli heyvanlar*.

**QƏLTAN** [*ər.*] Əsil mənası "bulanmış", "bulaşıq" olub, adətən, **qanına qəltan olmaq (etmək)** yaxud **al qana qəltan etmək** şəklində işlənir – qanına boyanmaq (boyamaq). [Səfər bəy Ramazana, Əhmədə:] *Əgər biriniz yaxın gəlsəniz, al qana qəltan edəcəyəm*. B.Talıblı.

**QƏLYAN** *is.* Tənbəki çəkməyə məxsus cihaz. *Qəlyan çəkmək*. – [Hacı Qara:] *Bu dükan sizə peşkəşdir; çubuqmu çəkirsiniz, qəlyanmı istəyirsiniz?* M.F.Axundzadə. *Qonaqlar eyvana çıxıb qəlyan, siqar çəkməyə məşğul oldular..* S.S.Axundov. *Çinar kölgəsində tüstülənməyir; İxtiyar babamın ağac qəlyanı!* S.Vurğun. ☐ **Sulu qəlyan** – tənbəkinin tüstüsünü sudan keçirən çəkim cihazı; nargilə. *Səyyah deyir: – Bu adətlər, əfsanələr; Qəlbimizə xoş görünür xəyal qədər; Sulu qəlyan, acı tiryək nə oldu bəs?* S.Vurğun.

**QƏLYANALTI** *is.* Səhər yeməyi. *Starşinadan taqımın qəlyanaltı yeyib, .. iclasa yığışdığını bilincə, Mədətov yerindən qalxaraq qazmadan bayıra sıçradı.* Ə.Əbülhəsən. // Yüngül yemək. *..Elə olmaz ki, günorta bir balaca qəlyanaltı hər nədən olsa olsun, amma axşam abi-guşt olmasa, mən heç yata da bilmərəm*. N.Vəzirov. ☐ **Qəlyanaltı etmək (eləmək)** – azacıq, yaxud tələsik bir şey yemək. *Kimi geyinib pəncərə qabağında durur, .. kimi öz kupesində çay-çörək hazırlayıb qəlyanaltı eləyirdi.* Mir Cəlal. // *dan.* Bəzən ayaqüstü yeməkxana mənasında.

**QƏLYANBAŞI** *is.* Qəlyanın, içərisinə tənbəki və od qoyulan hissəsi.

**QƏLYANBOĞAZ** *sif. dan.* Uzunboğaz.

**QƏLYƏ** *is. aşp.* Lobya, balqabaq, badımcan və s.-dən bişirilən xörək.

**QƏM** *is.* [*ər.*] Kədər, dərd, qüssə, könül tutqunluğu. *İnsanın təbiətində iki ümdə xasiyyət qoyulubdur: biri qəm, biri fərəh; ağlamaq əlaməti qəmdir, gülmək əlaməti fərəhdir.* M.F.Axundzadə. *Eşqin yolunda qəm verə üz, aşiq inciməz.* S.Ə.Şirvani. *Cahanda düşdüsə min qəmə, dərdə; Qaranlıq çəkmədi gözünə pərdə.* S.Vurğun. // Obrazlı təşbehlərdə. *Yaman gün keçər gedər; Ömrümü biçər gedər; Dünyada qəm şərbətin; Hər gələn içər, gedər.* (Bayatı). *Olubdu qəm yatağı şad gördüyün könlüm.* Heyran xanım. *Qəm mülkündən azad olum; Yaratdığım bir sənətlə!* S.Vurğun. *Qoy mən hicranınla qalım baş-başa; Sən qəm zəncirini qır, boynundan at.* R.Rza. *Qəm mizrabı min dərd çaldı onun ürək telində.* Ə.Cəmil. ☐ **Qəm çəkmək** – b a x **qəm yemək**. *Qəm çəkmə bu qədər divanə könül; Həmişə ruzigar belə dar olmaz.* Qurbani. *Könül, qəm çəkmə, dəhrin gülşənində; Açan hər bir gülün min xarı vardır.* Heyran xanım. [Hacı Murad:] *Allaha şükür, mənim kimi atan var, sən niyə qəm çəkəsən?* S.S.Axundov. **Qəm dəryasına batırmaq (qərq etmək)** – son dərəcə kədərləndirmək, qəmgin etmək, qəmləndirmək. *Məni qərq elədin qəm dəryasına; Ey çeşmi-xumarım, nöşün ağladın?* M.P.Vaqif. **Qəm dəryasına batmaq (qərq olmaq)** – son dərəcə qəmgin olmaq, pərişan olmaq, dərdli olmaq, kədərlənmək. *Məmmədhəsən əmi qəm dəryasına qərq olmuşdu*. C.Məmmədquluzadə. [Hacı Murad:] *İmran ağa, nə qəm dəryasına batmısan?* S.S.Axundov. **Qəm eləmək (etmək)** – b a x **qəm yemək**. [Qönçə:] *Qəm eləmə, işimiz düzələr, bir yerdə kəsbkarlıq edərik.* B.Talıblı. **Qəm yemək** – qəm çəkmək, fikir çəkmək, qəmə batmaq, dərd çəkmək. *Araz qəhqəhə ilə güldü, sonra əli ilə onun çiyninə vurdu: – Qəm yemə, bizimki soyulmaqdan gəlib, – dedi.* A.Şaiq. [Çimnaz:] *Qəm yemə, küsü nə qədər bərk isə, barışıq o qədər şirin olacaqdır..* Ə.Məmmədxanlı. **Qəmə batmaq** – b a x **qəm dəryasına batmaq**. [Dəli Səməd] *birdən nazik qollarını qırışdırıb və uzun ucuqırma burnunu sallayıb, belə qəmə batırdı ki, elə bil ömürdən məqsəd bilmərrə görmürdü.* Çəmənzəminli. **Qəminə qalmaq** – dərdinə qalmaq, qeydinə qalmaq, halı ilə maraqlanmaq. *Yar məgər yarını yadına salmaz? Arayıb-axtarmaz, qəminə qalmaz?* Q.Zakir. **Qəminə ortaq olmaq** – dərdinə şərik olmaq. *Bu gözəl aləmi gəzdikcə dağ-dağ; Oldum sevincinə, qəminə ortaq*. M.Müşfiq.

**QƏMALUD** *sif.* [*ər.* qəm və *fars.* ...alud] *klas*. Kədərli, qəmli, hüznlü; qəm gətirən, hüzn gətirən. *..Dərdim məgər azdır ki, sən də sübh vaxtı bu qəmaludə söhbəti başladın*. N.Vəzirov.

**QƏMAVƏR** *sif.* [*ər*. qəm və *fars*. ...avər] *klas*. Qəm gətirən, cansıxıcı. *Badkubənin qəmavər işlərindən qaçıb bir qədər təsəlli tapmaq istədim, o da belə çıxdı*.. N.Vəzirov.

**QƏMDİDƏ** *sif.* və *is.* [*ər*. qəm və *fars*. ...didə] *klas*. Qəm görmüş, qəm çəkmiş.

**QƏMƏ** *is.* Kiçik xəncər. *Əlini ətəyinin altındakı qəmənin dəstəsinə aparıb səsləndi: – Uşaqlar! Hazır olun!* M.S.Ordubadi. *Hər kəs dəyənək, tüfəng, qəmə, it götürüb getdi*. A.Şaiq. *Almurad baba .. dəri qından bir qəmə çıxardıb satıla çəkdi*. İ.Əfəndiyev.

**QƏMƏLƏMƏK** *f.* Qəmə ilə yaralamaq, qəmə ilə vurmaq.

**QƏMƏLƏNMƏK** *məch.* Qəmə ilə yaralanmaq, qəmə ilə vurulmaq.

**QƏMƏLİ** *sif.* Belinə qəmə bağlamış, belində qəmə olan, qəmə ilə silahlanmış. *Hamısı qəməli və patrondaşlı, bircə Qəhrəman yüzbaşı patrondaşını çıxarıb qoyub qabağına*. C.Məmmədquluzadə. *Hər dəvənin örkəni şişpapaq, beli qəməli bir sarbanın əlində idi*. Çəmənzəminli.

**QƏMƏLTİ** *is. məh*. Dəstəli kəsər alət, böyük bıçaq. *Göyçəyin indi qəməlti dediyi qara saplı iri bıçağı o ili Gorusdan təzə almışdım*. Ə.Vəliyev.

**QƏMƏNGİZ** *is.* [*ər*. qəm və *fars*. ...əngiz] *klas*. Qəm gətirən, qüssə gətirən.

**QƏMƏR** [*ər.*] 1. *is. şair*. Ay. *Süzülən nurunu toplayıb qəmər; Girdi buludlara, qaraldı göylər*. M.Rahim. *Yırğalanır göy sularda; O gecələr qızı qəmər*. N.Rəfibəyli. // *məc*. Klassik şeirdə gözəl üz mənasında. *Camalın günəşdir, qəmərdir üzün*. M.P.Vaqif. *Rüxsarına bənzər fələk üzrə qəmər olmaz*. S.Ə.Şirvani.

2. *sif.* Açıq-qara. *Qoşa qəmər atlarımın* [cilovlarını] *aldım əlimə*. C.Məmmədquluzadə. *Həyətdə bağlanmış qəmər madyanın yanında qaşqa bir qulun kişnəyib sıçrayırdı*. Ə.Vəliyev. *Yusif yəhərinin tərkində dolu xurcun olan qəmər madyanı tərpədib, .. kəndə tərəf sürdü*. Ə.Abasov.

**QƏMƏRÇÖHRƏ** *sif.* [*ər*. qəmər və *fars*. çöhrə] *klas*. b a x **qəmərüzlü**.

**QƏMƏRİ** *sif.* [*ər.*] Aya mənsub olan. *Qəməri il* (göydəki ay ilə hesab olunan il).

**QƏMƏRİYYƏ** *is.* [*ər.*] İçində oturub istirahət və ya söhbət etmək üçün bağlarda qurulan üstüörtülü, yanları açıq talvar; köşk. *Səhnə bağçada bir qəməriyyəni təsvir edir*. A.Şaiq.

**QƏMƏRSURƏT(Lİ)** b a x **qəmərüz**(lü).

**QƏMƏRÜZ(LÜ)** *sif. klas*. *şair*. Ayüzlü, aybəniz, gözəl. *Ey şəmsü qəmərüzlü, şirin dodağın duzlu; Vey şəhdü şəkər sözlü, didarına müştaqəm*. Nəsimi.

**QƏMFƏZA** *sif.* [*ər*. qəm və *fars*. ...fəza] *klas*. Qəm artıran, qəm gətirən. *Qəmfəza bir mənzərə təşkil qılmış kainat*. M.Hadi.

**QƏMGİN** *sif.* [*ər*. qəm və *fars*. ...gin] 1. Qəmli, kədərli, tutqun, məyus, pərişan. *Mən ömrümdə heç bir kəsə qəmgin və kədərli xəbərlər vermək istəmirəm*. M.S.Ordubadi. *Əmrah birdən duruxdu, qəmgin gözlərini evinə tərəf zillədi*. M.Hüseyn. *Yoxsa hüzn dolu qəmgin səsində; Dostumun muradı, ürək sözü var?* M.Rahim. // Zərf mənasında. *Məmməd Həsən əmi qəmgin .. oturub, gözünü dikmişdi şəhər yoluna*. C.Məmmədquluzadə. *Nurəddin çox qəmgin evə qayıdırdı*. S.S.Axundov. ☐ **Qəmgin olmaq** – kədərlənmək, tutulmaq, məyus olmaq, pərişan olmaq. *Qaraca qızın ürəkyandırıcı faciəsindən rəhmdil Piri kişi xeyli qəmgin oldu*. S.S.Axundov.

2. Qəm doğuran, kədər gətirən, hüzn doğuran, həzin; darıxdırıcı, cansıxıcı. *Qəmgin mənzərə. Qəmgin hadisə. – Hər tərəfə qəmgin sükut çökmüşdü*. M.Hüseyn. *Hər tərəf qaralır, fikrə qərq olmuş kimi görünən qəmgin qəbir daşları mavi bir pərdəyə bürünürdü*. S.Rəhman.

**qəmgin-qəmgin** *zərf* Qəmli halda, həzin-həzin. *Qərib-qərib, qəmgin-qəmgin ötərsiz; Üz tutubsuz nə məkanə, durnalar?* M.V.Vidadi. *Bu ellərin kefi onda saz olar; Siz, ey qəmgin-qəmgin ötən durnalar!* S.Rüstəm.

**QƏMGİNLƏŞDİRMƏ** "Qəmginləşdirmək"dən *f.is.*

**QƏMGİNLƏŞDİRMƏK** *f.* Qəmgin etmək, qəmgin göstərmək; kədərli etmək, kədərli göstərmək. *Bu işıq uşaqların solğun üzünü daha da qəmginləşdirirdi*. C.Cabbarlı.

**QƏMGİNLƏŞMƏ** "Qəmginləşmək"dən *f.is.*

**QƏMGİNLƏŞMƏK** *f.* Qəmgin olmaq.

**QƏMGİNLİK** *is.* 1. Qəmli, kədərli adamın halı.

2. Hüzn, kədər. *Bədii-ruhi təsir cəhətindən "Çargah" həyəcan və ehtiras, "Bayatı-şiraz" qəmginlik, "Humayun" isə "Şüştər"ə nisbətən daha dərin bir kədər hissi oyadır.* Ü.Hacıbəyov.

**QƏMXANƏ** *is.* [*ər.* qəm və *fars.* ...xanə] *klas.* Qəm evi, dərd-qəm gətirən yer. *Dil deməkdən kəsilib, tən hərəkətdən, vəh kim; Künci-qəmxanəyə bir surəti-divar olubam.* Füzuli. *Sevgilim, yalnız məhəbbətdir həyatın cövhəri; Bir könül ki, eşq zövqün duymasa, qəmxanədir.* Ə.Vahid.

**QƏMXAR** *sif.* [*ər.* qəm və *fars.* ...xar] *klas.* bax **qəmküsar**. *Ey munisi-ruzigarım ana! Qəmxarü qəmküsarım, ana!* Füzuli. *Düşmüşəm bir halə sənsiz natəvanü zar olub; Kim, əcəl yanımdan ayrılmaz, mana qəmxar olub.* Kişvəri. *Nə qədər var cahan, var olasız; Millətin dərdinə qəmxar olasız!* A.Səhhət.

**QƏMXARLIQ** *is. köhn.* Birinin dərdinə qalma, dərdinə şərik olma, birinin dərdli zamanında təsəlli vermə. *Yar əgər aşiqə qəmxarlıq etməzsə, nə qəm; Qəm odur, özgəyə məşuqəsi qəmxar olsa!* Ə.Vahid. *Ağlar halımıza biganə belə; Hardasan, gəl bizə qəmxarlıq eylə.* Şəhriyar.

**QƏMİŞ** *is.* 1. Bax **qamış**. *Stol üstündə bir dənə naxışlı gözəl qələmdan və bir qəmiş qələm var idi.* P.Makulu.

2. *məc. dan. zar.* Təngə gətirən, əl çəkməyən, zəhlə aparan, bezikdirən adam haqqında. *Söz deyirsən yenə çatmır qəmiş oğlu qəmişə; Mən ölüm, Kirpi dayı, yaxşı fikir ver bu işə!* Şəhriyar.

◊ **Qəmiş qoymaq** *dan.* – bir işin gedişinə, düzəlməsinə mane olmaq, müdaxilə edib əngəl törətmək. **Qəmiş olmaq** *dan.* – təngə gətirmək, əl çəkməmək, zəhlə aparmaq. [Məcid kişi:] *Əl-ayağa dolaşma burda, sən maşın sürəndə biz qıraqdan qəmiş olmuruq ki?!* İ.Şıxlı. **Qəmişini çəkmək** *dan.* – əl çəkmək, rədd olmaq, rahat buraxmaq. *Sən öl, sən bu ayın sahibi, məndən qəmişini çək! Dadaş canı, yaxamdan əl götür! Məni alverdən qoyma.* M.S.Ordubadi.

**QƏMİŞLİK** *is.* 1. Bax **qamışlıq**.

2. *dan. zar.* Zəhlə aparma, adamdan əl çəkməmə, adamı təngə gətirmək xasiyyəti.

**QƏMKÜSAR** *is.* [*ər.* qəm və *fars.* ...küsar] *klas.* Birinin dərdini çəkən, dərdinə, qəminə qalan, dərdinə şərik olan, təsəlli verən adam; dərd yoldaşı, sadiq dost. *Günbəgün könlümün artır qubarı; Pərişandır, tapmaz o qəmküsarı.* M.P.Vaqif. *Yar gərəkdir dildən yana yarına; Qəmü möhnət çəkə qəmküsarına.* Q.Zakir.

**QƏM-QUBAR** [*ər.*] bax **qəm**. *Noldu, xanım, niyə qondu çöhrənizə qəm-qubar?* Ə.Cəmil.

**QƏM-QÜSSƏ** [*ər.*] bax **qəm**. *Məmmədrza üçün dünyada qəm-qüssə yaranmamışdı.* S.S.Axundov.

**QƏMLƏNDİRMƏ** "Qəmləndirmək"dən *f.is.*

**QƏMLƏNDİRMƏK** *f.* Kədərləndirmək, kədərlənməsinə səbəb olmaq.

**QƏMLƏNMƏ** "Qəmlənmək"dən *f.is.*

**QƏMLƏNMƏK** *f.* Kədərlənmək, məyus olmaq, qəmə batmaq.

**QƏMLİ** *sif.* bax **qəmgin**. *Qəmli adam. Qəmli baxışlar. Qəmli nəğmə.* – *Çox-çoxdandır qəmli könlüm şad olmaz; Məgər əsməz dost kuyində yellər heç.* M.V.Vidadi. *Birdən-birə göründü gözə bir xərabəzar; Görsən nə qəmli mənzərələr aşkar idi.* M.Hadi. *Hüseyn günəşə baxaraq, nə isə qəmli, dərin şeylər düşünürdü.* S.Rəhman.

**qəmli-qəmli** *zərf* bax **qəmgin-qəmgin**. *Qızına qəmli-qəmli; Danışır həyatını; Küskün xatıratını..* M.Müşfiq.

**QƏMLİLİK** *is.* Qəmli adamın halı.

**QƏMNAK** [*ər.* qəm və *fars.* ...nak] *klas.* bax **qəmgin**. *Bir nalə qılan var dili-qəmnakdən özgə?* S.Ə.Şirvani. ☐ **Qəmnak etmək** – qəmləndirmək, kədərləndirmək. *Tərki-mey əmrilə qəmnak etmə, ey vaiz, bizi.* S.Ə.Şirvani. **Qəmnak olmaq** – qəmlənmək, kədərlənmək.

**QƏMSİZ** *sif.* və *zərf* Heç bir qəmi, dərdi, kədəri, qayğısı olmayan. *Qəmsiz adam.* – *O qəmsiz, qüssəsiz, o xoşbəxt üzü; Mənim ilhamıma yaxındır, düzü...* S.Vurğun. *Axirəti olanların dünyası qəmsiz olmayıb; Seldi, gələr, axar, keçər, amma gərək aşıb-daşa.* Şəhriyar.

**QƏMSİZLİK** *is.* Qəm, kədər, dərd, qayğı olmadığı hal.

**QƏMZƏ** *is.* [*ər.*] Naz, şivə, süzgün baxış, şivəli baxış. *Əqlü huşum mənim, fikrü xəyalım; Şux gözdə, qəmzədə bəstədir, ay qız!* M.P.Vaqif. *Gələndə mürğdilim ğəm gölündə pərvazə; Xədəngi-qəmzə ilə həm şikar edən sən idin.* X.Natəvan. *Qəmzəsi can alan, gərdişi əla; Doğrudan gözəldir, göyçəkdir Leyla.* Ə.Cavad. □ **Qəmzə satmaq** – naz etmək. *Şəbnəmli çiçəklər səhər çağları; Yaqut gözlərilə qəmzə satırdı.* R.Rza.

**QƏMZƏDƏ** *sif.* [*ər.* qəm və *fars.* ...zədə] *klas*. Qəmli, kədərli; bədbəxt, yazıq. *Ziyadə qəmzədəyəm hicr ilə, xoş ol günlər; Ki, mən bu qəmzədəlikdən ziyadə xürrəm idim*. Füzuli. *Bəzm əhli dikibdir sənə yeksər gözün, amma; Gözlə məni, cana ki, füzun qəmzədəyəm mən.* Q.Zakir. // İs. mənasında. *Füzuli, demək olur ki, aləmi-insaniyyətdə tamam qəmzədələrin və möhnətkeşlərin yüklərini götürmək və məzlumların halına yanmaq üçün xəlq olunmuşdur.* F.Köçərli.

**QƏMZƏDƏLİK** *is.* Qəmlilik, kədərlilik; bədbəxtlik.

**QƏMZƏKAR** [*ər.* qəmzə və *fars.* kar] b a x **qəmzəli**.

**QƏMZƏLİ** *sif.* Naz verən, nazlı, şivəli. *Bir afətə, bir nigarə uydum; Bir qəmzəli işvəkarə uydum*. H.Cavid. *Ziba nimtənəli, tikmə köynəkli; Gözləri qəmzəli, qallı sənəm, gəl!* Xəstə Qasım. *Hər yanaqda qızılgülün rəngi var; Hansı iyid ürəyinə ox olub; Sanılmayıb o qəmzəli baxışlar*. R.Rza.

**QƏNAƏT** *is.* [*ər.*] 1. Bir şeyi ehtiyatla, sərfəli və səmərəli işlətmə, artıq işlətməmə, israf etməmə. *Qənaət etmək. Qənaət üsulu. Materiala, yanacağa və elektrik enerjisinə qənaət edin! Sahələrin düzgün hamarlanması .. suvarma zamanı suyu qənaətlə* (z.) *işlətmək imkanı yaradır.* □ **Aza qənaət etmək** – əlində olan azacıq şeylə kifayətlənmək, qənaətlə dolanmaq. *Hamı öz xırdaca təsərrüfatları ilə aza qənaət edib, dinc və sakit bir ömür keçirirdilər.* M.Rzaquluzadə. // Bir şeyin ehtiyatla, sərfəli və səmərəli işlənməsi, israf edilməməsi nəticəsində əldə edilən xeyir, fayda. *Yanacaq sahəsində böyük qənaət var. Sənayemiz əldə etdiyi qənaət hesabına əlavə olaraq milyard manatlıq artıq məhsul buraxmışdır.*

2. Kifayətlənmə, qane olma. □ **Qənaət etmək** – kifayətlənmək, qane olmaq. *Bununla qənaət etmək lazımdır. Onun dedikləri ilə qənaət etmək olmaz. – Saqi, şərabımız qutarır, yarıdır gecə; Bir az qənaət eylə, səbuhi-xumar üçün.* Ə.Vahid.

3. Fikir, yəqinlik. *Belə bir qənaət var idi ki, artist mütləqa suflyor altında getməlidir.* S.Rəhman. □ **Qənaətə gəlmək** – yəqin etmək, qəti fikrə gəlmək, nəticəyə gəlmək.

**QƏNAƏTBƏXŞ** *sif.* [*ər.* qənaət və *fars.* ...bəxş] Qənaətləndirici, kifayətləndirici, qaneedici. *Qənaətbəxş iş. Qənaətbəxş cavab.* – [Fəxrəddin:] *Məktub olduqca qənaətbəxş bir məktubdur*. M.S.Ordubadi. // Zərf mənasında. *Yerli komitənin fəaliyyəti qənaətbəxş hesab edildi. Məsələ qənaətbəxş həll edildi.*

**QƏNAƏTCİL** *sif.* 1. Hər şeyə qənaət edən, azla kifayətlənən. *Qənaətcil adam*. – *Müdrik adamlar deyiblər:* "*Abadlıq istəyirsinizsə, çalışqan olun, dövlət istəyirsinizsə, qənaətcil olun, çox dost istəyirsinizsə təvazökar olun*". "Qabusnamə".

2. Qənaətə imkan verən, mənfəətli, səmərəli.

**QƏNAƏTCİLLİK** *is.* Hər şeyə qənaət etmə, azla kifayətlənmə.

**QƏNAƏTÇİ** *sif.* və *is.* Qənaət edən, israf etməyən, israfçılığa yol verməyən; azla kifayətlənən, hər şeyi qənaətlə işlədən.

**QƏNAƏTÇİLİK** *is.* Qənaət etmə, israfçılığa yol verməmə, hər şeyi qənaətlə işlətmə; az bir şeylə kifayətlənmə.

**QƏNAƏTKAR** *sif.* [*ər.* qənaət və *fars.* ...kar] Hər şeyi qənaətlə, sərfəli işlədən, hər şeyə qənaət edən, qənaətlə dolanan; qənaətcil. *Qənaətkar adam*. – [Gülbala] *öz sənətini sevən, son dərəcədə qənaətkar, ağırtəbiətli bir kəndli idi.* A.Şaiq. *Zeynal indi öz evinə qayıtmaq, ailəsinin şəfqətli qanadları altına sığınıb qənaətkar bir zəhmətkeş həyatı yaşamaq istəyirdi*. S.Hüseyn.

**QƏNAƏTKARANƏ** *zərf* [*ər.* qənaət və *fars.* ...karanə] Qənaətkarcasına, qənaətkarlıqla, qənaətlə, azla kifayətlənərək.

**QƏNAƏTKARLIQ** *is.* Qənaət etmə; bir şeyi qənaətlə, ehtiyatla, sərfəli işlətmə, qə-

naətlə dolanma; qənaətcillik. [Mehriban] .. *uşaqlarını və evini sevə bilir. Qənaətkarlığı da bacarır.* S.Hüseyn.

**QƏNAƏTLƏNDİRİCİ** *sif.* Qaneedici, kifayətləndirici, inandırıcı. *Qənaətləndirici cavab. Qənaətləndirici nəticə. Qənaətləndirici iş.*

**QƏNAƏTLƏNDİRİCİLİK** *is.* Qane edicilik, kifayətləndiricilik; inandırıcılıq. *Cavabın qənaətləndiriciliyi.*

**QƏNAƏTLƏNDİRMƏ** "Qənaətləndirmək"dən *f.is.*

**QƏNAƏTLƏNDİRMƏK** *f.* Kifayətləndirmək, qane etmək; inandırmaq, razı salmaq, təmin etmək. *Onun cavabı məni qənaətləndirmədi. Göstərilən səbəblər heç kəsi qənaətləndirə bilməz. – Hacı Səməd xan məni çox diqqətlə dinləyirdi. Sözlər onu qənaətləndirmişdi.* M.S.Ordubadi.

**QƏNAƏTLƏNMƏ** "Qənaətlənmək"dən *f.is.*

**QƏNAƏTLƏNMƏK** *f.* 1. Kifayətlənmək, qane olmaq; aza qane olmaq.

2. Az şeylə kifayətlənmək.

**QƏNAƏTLİ** *sif.* 1. Qənaət verən, kifayət edən, qənaətləndirici.

2. Kifayətlənən; aza qane olan.

**QƏNAƏTLİLİK** *is.* Qənaət etmə, kifayətlənmə; aza qane olma, az bir şeylə kifayətlənmə.

**QƏNAƏTSİZ** *sif.* Qənaət etməyən, qənaət gözləməyən; israfcıl. *Qənaətsiz adam. – Qənaətsiz qənaətdən; Təntənəli cəhalətdən yorulmadın?* R.Rza.

**QƏNAƏTSİZLİK** *is.* Qənaət etməmə, hər şeyi qənaətsiz, sərfəsiz işlətmə; israfçılıq.

**QƏNARƏ** *is.* Kəsilmiş heyvanların cəmdəyini asmaq üçün iri qarmaq. *Əti qənarədən asmaq. – Qurban götür kəs məni; Qənarədən as məni; Al könlümü, saz eylə; Sinən üstə bas məni.* (Bayatı).

**QƏNBƏR** *is. məh.* Çaydaşı, küçələrə döşənən daş. [Səttar:] *Pirallahıdan bu yanda balaca bir ada var, bir dəfə atam ora qaşqaldaq ovuna getmişdi, məni də aparmışdı, kimsə orda qənbərdən bir daxma tikib, amma içində heç kim olmur..* Ə.Məmmədxanlı.

**QƏNBƏRQULU** *is. dan.* Cəncəl, əngəl, xata. *Bu işin qənbərqulusu var.* – [Xaspolad:] *İnsanın gərək zatında qənbərqulu olmasın.* C.Cabbarlı.

◊ **(İçindən) qənbərqulu çıxmaq** – xata çıxmaq, arzuedilməz bir iş çıxmaq. [Mehdi bəy:] *Ağızdır, bir xatalı söz buraxdın, içindən qənbərqulu çıxdı.* S.S.Axundov.

**QƏNBƏRLİK** *is. məh.* Qənbər döşənmiş yer.

**QƏND** *is.* [*ər.*] Şəkər çuğunduru və ya şəkər qamışından hasil edilən ağ kristal şəklində şirin qida maddəsi; şəkər. *Parça qənd. Tikə qənd* (doğranmış halda olan qənd). *Kəllə qənd* (kəllə şəklində istehsal olunan qənd). // *məc.* Çox şirin şey haqqında. *Yemiş deyil, qənddir.*

**QƏNDAB** *is.* [*ər.* qənd və *fars.* ab] Şərbət. *Çavuş qəndabı içib corabı aldı və qoydu atının tərkindəki xurcuna.* C.Məmmədquluzadə. *Təkyələrdə çay və qəndab sel kimi axırdı.* Ə.Haqverdiyev. // *məc.* Çox şirin şey haqqında. *Ey dəhani şəkər, ləbləri qəndab!* M.P.Vaqif.

**QƏNDABİ** *sif.* [*ər.* qənd və *fars.* abi] Şərbətli, şirin, şirni qatılmış. [Ağa Mərdan:] *Ağa Kərim, bizim nökərlərdən birisini göndər, bazardan çilovpəzdən 4 nəfər üçün .. qəndabi çilov gətirsin.* M.F.Axundzadə.

**QƏNDDAN** [*ər.* qənd və *fars.* ...dan] b a x **qəndqabı**. *..Dördkünc ağ qənddanlar bahalı konfet və şirni ilə doldurulmuşdu.* Ə.Vəliyev.

**QƏNDDİŞLƏYƏN** b a x **qənddoğrayan**.

**QƏNDDOĞRAYAN** *is.* Qənd doğramaq üçün kəlbətin.

**QƏNDİL** *is.* [*ər.*] Asma lampa. *Körpünün daş qapıları və yüz arşın ucalığındakı tağlar minlərcə qəndillərin əlvan şəfəqləri altında parlayırdı.* M.S.Ordubadi. *Oğlan cəld onu* [qadını] *qaldırıb əmr etdi ki, tavandan asılmış beşçıraqlı qəndili düşürüb ona versinlər.* Ə.Haqverdiyev. *Küncdə yanan qəndilin zəif titrək işığında zirzəmi hərəkət edən kölgələrlə dolu görünürdü.* M.Rzaquluzadə.

**QƏNDİLLİ** *sif.* Qəndilləri olan, qəndillər asılmış, qəndillərlə bəzədilmiş və işıqlandırılmış.

**QƏNDQABI** *is.* Qənd qoymaq üçün qab; qənddan. *Şəbanın evini alt-üst etdilər. Həqiqət .. iki dəst gümüş çəngəl-bıçaq, neçə gümüş qəndqabı və sair şeylər tapıldı.* Ə.Haqverdiyev.

**QƏNDQIRAN** b a x **qənddoğrayan**.

**QƏNDSINDIRAN** b a x **qənddoğrayan**.

**QƏNƏPƏ** [əsli *fr.*] *köhn.* Taxt, divan. *İskəndər görüşüb, yumşaq qənəpənin üstündə oturdu*. Çəmənzəminli.

**QƏNİ** *sif.* [*ər.*] *köhn.* Varlı, dövlətli, zəngin. *Vəslindən oldum çün qəni, bən mülkü malı neylərəm*. Nəsimi. *Aç kiseyi-səxavətüvün bəndin, ey qəni!* M.Möcüz. *Məclis vaqe olur qəni və Avropa qaydası ilə bəzənmiş Saranın otağında.* C.Cabbarlı. *Mən səni dünya malından qəni edərəm.* İ.Əfəndiyev.

**QƏNİM** *is.* [*ər.*] Düşmən. *Hay-hay deyib qənim üstə varanda; Kəllə gərək bu meydanda qalanı.* "Koroğlu". *Bax, bizim qənimimiz indiyədək bizi əsarətdə saxlayan həmin çarşab olubdur*. C.Məmmədquluzadə. // Birinin öhdəsindən gələn, gözünün odunu alan, qəddar düşməni olan; dəhşət, qorxu yağdıran; bir şeyin tam ziddi. *Qoyunun qənimi qurddur. Pişik siçanın qənimidir. – Hər şeyin bir qənimi, bir zavalı var*. M.İbrahimov. *Dekabrda olduğu kimi, bu batareya iyunun birindən bəri də düşmən təyyarələrinin qənimi idi*. Ə.Əbülhəsən. ☐ **Qənim kəsilmək, qənimi olmaq** – düşmən kəsilmək, düşməni olmaq, öhdəsindən gəlmək, gözünün odunu almaq, öz gücünü tanıtmaq. *Komandir tamamilə əmin olmuşdu ki, qorxu bilməyən gənclər düşmənin amansız qənimi olur.* Ə.Vəliyev. **Qənim olmaq** *din*. – cəzasını vermək, uğursuzluğa məruz qoymaq, öz təsirini göstərmək. *Xalalardan birisi gəlib mənə xəbər verdi ki,* "*Molla Nəsrəddin*" *jurnalı bağlanıbdır. Pirin kəramətini gördünmü, necə ona qənim oldu?* "Mol. Nəsr."

**QƏNİMƏT** *is.* [*ər.*] 1. Müharibədə düşməndən alınan hər cür şey. *Atlı bölüklər meydandan çapıb keçərkən dünənki döyüşdə düşməndən qənimət aldıqları qara bayraqları ağ daşdan tikilmiş 7 zəfər sütunu önündə yerə atırdılar...* Ə.Məmmədxanlı.

2. Təsadüfən ələ keçən və bir daha ələ keçməsi mümkün olmayan şey, tapılmış kimi olan şey. *Doğrudur, kəndlərdə və balaca şəhərlərdə qışın o qədər bir səfası yoxdur, amma Tiflis kimi yerdə qış böyük bir qənimətdir.* C.Məmmədquluzadə. // Fürsət. *Bir belə .. şəxs ilə qohum olmaq elə bir qənimətdir ki, dünyada az-az adama qismət ola bilər.* C.Məmmədquluzadə. *Etməyin qəflət, bu fürsətdən qənimət vaxtıdır*. M.Ə.Sabir. ☐ **Qənimət bilmək (saymaq)** – fürsət bilmək, fürsətdən istifadə etmək, tapılmış kimi bilmək. *Gülün vüsalını gülzardə qənimət bil; Ki, bir də ömrünə yox etibar, ey bülbül!* S.Ə.Şirvani. *Mən də kağız tapa bilməyib, divarın səhifələrini qənimət bilirdim ki, orada Usta Zeynalın bədbəxtliyini təsvir edim.* C.Məmmədquluzadə. *Osman kişi ömrünün hər dəqiqəsini qənimət bilir, hər anından həzz alır.* Ə.Sadıq.

**QƏNİMƏTÇİ** *is.* Hər şeyi qənimət bilən, fürsətdən istifadə edərək bir şey qoparmağa çalışan, cürbəcür yollarla öz işindən öz şəxsi xeyri üçün mümkün qədər daha çox fayda götürməyə cəhd edən adam.

**QƏNİMƏTÇİLİK** *is.* Hər şeyi qənimət bilmə, fürsətdən istifadə edərək, bir şey qoparmağa, cürbəcür yollarla öz işindən şəxsi xeyri üçün, mümkün qədər daha çox fayda götürməyə çalışma.

**QƏNİR** *is. dan.* Tay, misil, bərabər. [Zeynəb:] *Yox, o, quş deyil, gəlindir. Özü də deyirlər, gözəl bir gəlin olub. Elə bir gəlin ki, su sonası kimi, bir qənir üzünə baxmaq olmurmuş.* İ.Şıxlı.

**QƏNİRSİZ** *sif. dan*. Tayı-bərabəri olmayan, misilsiz. *El nağıllarında belə qızlara qənirsiz gözəl deyirlər.* M.Hüseyn. *Əziz Gülsəbaya deyirdi: – Kəndimizin qənirsiz gözəli sənsən.* Ə.Vəliyev. *Mənə deməyin ki,* "*Cahandan az de; Nə çoxdur qənirsiz qızlar, gözəllər!*" Ə.Cəmil.

**QƏNNADI** *is.* Qənddən emal edilən hər növ şirniyyat. *Qənnadı məmulatı. Qənnadı fabriki.* – [Mirzə Qulam:] *Yadımızdan çıxıb, – dedi, – burada bir yaxşı qənnadı mağazası var*. Mir Cəlal. [Fidan] *dedi ki, .. anası qənnadı fabrikində ustadır.* İ.Məlikzadə.

**QƏNNADIÇI** *is.* Qənnadı (şirniyyat) hazırlamaqla məşğul olan adam; şirniyyatçı. *Qəssab məsələni anlayıb, çobanı Şeytanbazara bir qənnadıçının yanına yollayır*. Çəmənzəminli.

**QƏNNADIÇILIQ** *is.* Qənnadıçı sənəti, peşəsi. [Bakıda] *əhalinin bir qismi də xırda*

*ticarətlə – çayçılıq, kababçılıq, həlmaşıçılıq, qənnadıçılıqla məşğul olardı*. H.Sarabski.

**QƏNŞƏR** *is*. Qarşı tərəf, ön tərəf; irəli, qabaq. *Qapının qənşəri. Evin qənşərində. – Kəndlinin qənşərində bir sürü qaz; Bir çubuqla sürürdü çox saymaz.* A.Səhhət. *Yanında xırda gümüş qaşıq olan fincan isə qocanın qarşı tərəfindəki həsir səndəlin qənşərinə qoyulmuşdu.* İ.Əfəndiyev. ☐ **Qənşər gəlmək** – üz-üzə gəlmək, rast gəlmək. *Uğura qənşər gələsən, oğul, – deyə qoca çobanın qolundan tutub öz yanında oturtdu.* M.Rzaquluzadə. // Qarşıda yaxşı görünən yer. [Səmədi] *Krım çöllərində Üçtəpə adlanan qənşər bir yerdə basdırdı*(*lar*). Ə.Vəliyev.

**QƏNŞƏRLƏMƏK** *f.* Qabağa çıxmaq, qarşılamaq.

**QƏNŞƏRLİK** *is*. Önlük, döşlük.

**QƏPİK** *is*. [*rus*. копейка] Manatın ən kiçik ölçü vahidi.

◊ **Qəpiyə güllə atmaq** – heç pulu olmamaq. **Bir qəpiyə dəyməz** – heç bir qiyməti, dəyəri, əhəmiyyəti olmayan şey haqqında. *Hər bir şeyin qondarması bir qəpiyə dəyməz*. C.Məmmədquluzadə.

**qəpik-qəpik** *zərf* Qəpiklərdə, bir qəpik-bir qəpik. *Dama-dama göl olar, qəpik-qəpik yığılıb ağca manat əmələ gələr*. N.Vəzirov.

**QƏPİK-QURUŞ** *is*. Xırda pul, azacıq pul, əhəmiyyətsiz məbləğ. *Gəlib-gedən məxluqa baş vururam; Bundan, ondan qəpik-quruş alıram..* A.Səhhət.

**QƏPİKLİK** *is*. Bir qəpik qiymətində olan. ☐ **Bir qəpiklik** – dəyərsiz, qiymətsiz, əhəmiyyətsiz şey haqqında. *Bunun bir qəpiklik xeyri yoxdur*. – *Bir saatlıq rahatı, bir qəpiklik mənfəəti heç bir şeyə dəyişmirik*. C.Məmmədquluzadə.

**QƏPİKPƏRƏSTLİK** *is. dan.* Qəpikgüdmə, pulpərəstlik; xəsislik. *Halva demək ilə ağız şirin olmaz, qəpikpərəstlik bizim evimizi yıxıb, gecə-gündüz vaxtbevaxt fikrimiz-zikrimiz qəpikdir*. N.Vəzirov.

**QƏRABƏT[1]** *is*. [*ər.*] 1. Qəriblik; yurdundan, vətənindən ayrı düşmə. *Məgər zülflərindən bəhs edən sünbül; Düşər ayaqlara qərabət çəkər.* Aşıq Valeh.

2. Təəccüblülük, əcaiblik, qəribəlik.

**QƏRABƏT[2]** *is*. [*ər.*] 1. Yaxınlıq.

2. Qohumluq. [Teymur ağa:] *Məgər mən ölmüşəm ki, səni vəzir özgəsinə verə bilə? Axır bu qərabətdən onun mənzuru nədir?* M.F.Axundzadə.

**QƏRAİB** [*ər*. “qəribə” söz. cəmi] b a x **qəribə**. *Suraxanıda əcaib və qəraib adlara rast gəlmək olardı*. H.Sarabski. // Qəribə şey, görülməmiş şey. *Gündə bir fənn qoyur ərsəyə əfkari-bəşər; Min qəraib çıxarır əqli-ziyadari-bəşər.* Ə.Nəzmi.

**QƏRAR[1]** *is.* [*ər.*] 1. Bir məsələni müzakirə etdikdən sonra, hamı tərəfindən çıxarılan nəticə; qətnamə. *Qərar layihəsi. Qərarı müzakirə etmək.* ☐ **Qərar vermək (qoymaq)** – bir şeyi müzakirə etməkdən, yaxud bir şey haqqında düşündükdən sonra müəyyən nəticəyə gəlmək, qəti bir fikrə gəlmək, qət etmək. *Bir neçə gün Şəbanın yanına dost və aşna gəldi; axırda Şaban arvadını da götürüb öz evinə köçməyə qərar qoydu.* Ə.Haqverdiyev. **Qərara gəlmək (almaq)** – qərar çıxarmaq, qərar qəbul etmək. [Baba:] *..Yığıncağınızda nə qərara gəldiniz?* S.S.Axundov; // b a x **qərar vermək (qoymaq)**. *Axırda bu qərara gəldilər ki, .. qoca kəndli onların mübahisəsini həll etsin.* S.S.Axundov. *Məsmə otağını bir cavanəzənə yaraşacaq bir şəklə salmağı özünə bir həyat qayəsi qərar verir.* S.Hüseyn. // Hüquq termini kimi. *Məhkəmənin qərarı. Qərar qətidir. Məhkəmə qərar çıxardı. Məhkəmə qərarı və ya prokurorun icazəsi olmadan heç bir kəs həbs edilə bilməz.*

2. Fikir, mülahizə; əzm. *Heç bir şey məni öz qərarımdan daşındıra bilməz*. – *Heç bir təhlükə, heç bir qorxu* [Firidunu] *qərarından döndərə bilmədi.* M.İbrahimov.

3. Qərarlaşma, sözləşmə, qabaqcadan danışıb şərtləşmə. *Elə ki libas geyinmək tamam oldu, miraxur atı qabağa çəkdi, Yusif Sərracı mindirdilər ata, əsas qərari-sabiq üzrə dərbari-şahiyə rəvanə oldu*. M.F.Axundzadə.

◊ **Qərarla, qərar ilə** – qayda ilə, qaydada, üsul ilə, tərz ilə, sayaq. [Hacı Nayib:] *Əhvalat bu qərar ilədir ki, hər bir hakimin birinci vəzifəsi məmləkətin abadlığı və əhalinin istirahət və səadətidir*. C.Məmmədquluzadə. *Bu qərarla Təbrizdən hərəkət etdiklərinin 9-cu günü Dəclə çayı sahillərinə*

*yaxınlaşdılar.* M.S.Ordubadi. □ **Bir qərarla** – bir qaydada; üsulu, qaydanı, sürəti, ahəngi və s.-ni dəyişdirmədən, müntəzəm surətdə. *Su bir qərarla axır. Bir qərarla nəfəs almaq. Bir qərarla yerimək. Bir qərarla oxumaq.*

**QƏRAR²** *is.* [*ər.*] Durma, durum, sakit durma. // Aram, rahatlıq. *Dilbər, sən gedəndən bəri könlümün; Nə səbri, sükutu, nə qərarı var.* Q.Zakir. *Könüldə yox qərarü səbr, ey arami-can, sənsiz.* S.Ə.Şirvani. □ **Qərar tapmaq (tutmaq)** – 1) bir yerdə, ya bir işdə sabitləşmək, dayanmaq. *Olduğu yerdə qərar tapdı;* 2) aram olmaq, sakitləşmək, rahat olmaq. *Uşaq daha ağlamır, qərar tapdı. – Qərarım tutarmı onu anmasam; Onun xəyalıyla oda yanmasam?* Ə.Cəmil. *O, bir dəqiqə bir yerdə qərar tapmayaraq, sərbəst hərəkəti ilə öz azadlığını təsdiq etməyə can atırdı.* Ə.Məmmədxanlı; 3) dayanmaq, yerləşmək, oturmaq. *Paşanın adamları da hərəsi bir tərəfdə qərar tutdular.* "Koroğlu". *Xan yuxarı başa keçib, bir yumşaq döşək üstündə əyləşib qərar tutdu.* Ə.Haqverdiyev. **Qərardan düşmək (getmək)** – 1) daha dözə bilməmək, səbr edə bilməmək, səbri tükənmək; 2) huşu başından çıxmaq, özünü itirmək. *Xəstə qızdırmanın şiddətindən qərardan getmişdi.* **Qərarı gəlməmək** – səbri çatmamaq, hövsələsi çatmamaq, bir yerdə duruş tutmamaq. *Musa kişi bütün günü heç bir iş görə bilmirdi. Nəyə əl atırdısa, qərarı gəlmirdi.* M.İbrahimov. **Qərarı kəsilmək** – 1) səbri gəlməmək, səbri kəsilmək; 2) taqəti kəsilmək. **Qərarı üzülmək** – b a x **qərarı kəsilmək**. **Qərarını almaq** – b a x **qərarını kəsmək**. **Qərarını kəsmək** – səbrini, rahatlığını, aramını əlindən almaq, tükəndirmək. *Gər kəsməsəydi bülbüli-zarın qərarını; Olmazdı aqibət özü həm biqərar gül.* S.Ə.Şirvani.

**QƏRARDAD** *is.* [*ər.* qərar və *fars.* ...dad] *köhn.* Qərar, qətnamə; hökm, rəsmi sərəncam, əmr. [Əziz bəy:] *Mənim xatirimi istəyir və vədə edibdir ki, mənə xidmət rücu edib vəzifə qərardad eləsin.* M.F.Axundzadə. *Bu* [məktəblərin] *üçü də qərardadın məzmununa görə lazım idi.* C.Məmmədquluzadə.

**QƏRARGAH** *is.* [*ər.* qərar və *fars.* ...gah] 1. Qərar tutulan yer, dincəlmək yeri; ev, məskən. *Məcnunun bəxtiyar və gənc yaşında; Axır qərargahı oldu biyaban.* S.Vurğun.

2. *hərb.* Qoşunları idarə edən orqan, ştab. *Ordu qərargahı. – Onların qərargahı .. sıldırım qayalıqlar üzərindəki kiçik bir qalada yerləşmişdi.* M.Hüseyn. *Cavad bəy Cahangir bəylə birlikdə qalanın keşikçi dəstəsini möhkəmlətdikdən sonra qərargaha qayıtdılar.* İ.Şıxlı.

3. *məc.* Ümumiyyətlə, bir işə rəhbərlik edən orqan.

**QƏRARLAŞDIRILMA** "Qərarlaşdırılmaq"dan *f.is.*

**QƏRARLAŞDIRILMAQ** *məch.* 1. Yerbəyer edilmək, yerləşdirilmək, yeri müəyyənləşdirilmək, sabitləşdirilmək.

2. Müəyyənləşdirilmək, qət edilmək, söz bir araya gətirilmək.

**QƏRARLAŞDIRMA** "Qərarlaşdırmaq"-dan *f.is.*

**QƏRARLAŞDIRMAQ** *f.* 1. Yerbəyer etmək, yerləşdirmək, yerini müəyyənləşdirmək. // Sabitləşdirmək, möhkəmlətmək.

2. Müəyyənləşdirmək, müəyyən fikrə gəlmək, bir qərara gəlmək, kəsdirmək, qət etmək. // Etməyi, görməyi nəzərdə tutmaq. *Qız .. əvvəlcə qərarlaşdırdığı mövzudan kənara çıxdı.* M.S.Ordubadi.

**QƏRARLAŞMA** "Qərarlaşmaq"dan *f.is.*

**QƏRARLAŞMAQ** *f.* 1. Yerbəyer olmaq, yerləşmək, qərar tapmaq, sakin olmaq. *Təzə mənzildə qərarlaşmaq.* // Müəyyənləşmək, sabitləşmək.

2. Biri ilə bir şey haqqında sözləşmək, bir rəyə, fikrə gəlmək, bir qərara gəlmək. *Mahru ilə razılaşdıq, qərarlaşdıq.* M.S.Ordubadi. *Mirzəcanın yeganə bir çarəsi vardısa, o da yeni qayda ilə iş görmək idi, yəni Cəmilənin özü ilə danışıb qərarlaşmalı idi.* S.Hüseyn. *Onlar səhər saat beşdə yola düşməyi qərarlaşıb ayrıldılar.* M.İbrahimov.

**QƏRARLI** *sif.* Sabit, səbatlı, dözümlü, sözündə, qərarında möhkəm.

**QƏRARNAMƏ** *is.* [*ər.* qərar və *fars.* ...namə] b a x **qərar¹** 1-ci mənada. *İclasın qərarnaməsi.*

**QƏRARSIZ** *sif.* 1. Aramsız, durumsuz, bir yerdə qərar tapa bilməyən; səbirsiz, dözümsüz. *Qərarsız uşaq.*

2. Səbatsız, davamsız, mütərəddid, dəyişkən, daim dəyişən. *Qərarsız adam. Hava bu gün çox qərarsızdır.*

3. Rahatsız, narahat, iztirablı. *Könlüm çox qərarsızdır. – ..Qaynanasının ona ürək-dirək verməsinə baxmayaraq, Durna qərarsız oldu.* İ.Əfəndiyev.

4. Arasıkəsilməz, aramsız, uzunsürən. *Yağış qərarsız* (z.) *yağır.*

**QƏRARSIZLIQ** *is.* 1. Aramsızlıq, durumsuzluq, səbirsizlik, dözümsüzlük; bir yerdə qərar tapa bilməmə.

2. Səbatsızlıq, davamsızlıq, dəyişkənlik, daim dəyişmə; mütərəddidlik.

3. Rahatsızlıq, narahatlıq, iztirablı hal.

4. Arasıkəsilməzlik, aramsızlıq.

**QƏRAYİ** *is.* [*ər.*] *mus*. Muğamatın bölündüyü hissələrdən birinin adı. "*Əraq*"*dan sonra ilk mayəyə qayıtmaq tələb olunur. Bu qayıtma* "*qərayi*" *vasitəsilə olur.* Ü.Hacıbəyov. "*Rast*"*ın aşağıdakı hissələri vardır: üşşaq, vilayəti, iraq, qərayi..*

**QƏRB** *is.* [*ər.*] 1. Dünyanın, günəşin batdığı cəhəti. *Günəş şərqdən çıxıb qərbdə batır.* // Şərqə müqabil olan səmt, cəhət. *Kəndin qərb tərəfi meşəlikdir. – Gedir qərbə tərəf hücumçəkənlər; Gedir qatar-qatar bombatökənlər.* M.Rahim.

2. Günbatan istiqamətində yerləşən ölkələr, məmləkətlər, yerlər. *Qərb ölkələri. Qərb ədəbiyyatı. Qərb musiqisi.*

**QƏRBÇİ** *is. tar*. Qərbçilik tərəfdarı (b a x **qərbçilik**).

**QƏRBÇİLİK** *is. tar*. Rusiyada təhkimçilik üsulunun pozulması dövründə ortaya çıxaraq, Rusiyanın Qərbi Avropa kimi kapitalizm inkişafı yolu ilə getməsi ideyasını müdafiə edən burjua ideologiyası.

**QƏRBİ** *sif.* [*ər.*] Qərbə mənsub, günbatana mənsub və aid olan. *Qərbi Avropa. Qərbi Sibir*.

**QƏRBİYYUN** *is.* [*ər.*] *köhn*. 1. Qərb məmləkətləri əhalisi, qərblilər, avropalılar.

2. Qərb mədəniyyəti tərəfdarı (b a x **qərbçi**).

**QƏRBLİ** *is.* və *sif.* Qərb ölkələrinin birində doğulub yaşayan adam. *Bəlkə də bir; Qərbli qonaq; Deyərdi ki, insana bax!* M.Araz.

**QƏRƏNFİL** *is.* Rəngbərəng növləri olan ətirli gözəl bir çiçək. *Qərənfil bağçanın yaraşığıdır. – Səni kimdir sevən bica, qərənfil! Sənə mən aşiqi-şeyda, qərənfil!* X.Natəvan. [Xədicə] *əlində tutduğu bir qərənfil çiçəyini mənə tərəf atdı.* S.Hüseyn.

**QƏRƏNFİLÇİÇƏKLİLƏR** *cəm bot.* Birillik ot və yarımkol bitkilər fəsiləsi.

**QƏRƏNFİLLİK** *is.* Çoxlu qərənfil bitən yer.

**QƏRƏZ**[1] *is.* [*ər.*] 1. Məqsəd, niyyət, məram *..Bu qələçələri təmir etməkdən qərəz bu idi ki, taifeyi-Xəzər Dərbəndə qələbə və təsəllüt edə bilməsinlər.* "Dərbəndnamə". [Hacı Qara:] *Bəs indi mənim yanıma gəlməkdən qəraziniz nədir?* M.F.Axundzadə. [Bədircahan bəyim:] *Mən qana bilmirəm, sənin qərəzin nədir?* N.Vəzirov.

2. Gizli məqsəd, pis niyyət, gizli ədavət. *Şəxsi düşmənlərdən doğan tənqid bir parça qərəzdən ibarətdir.* M.S.Ordubadi. *Şəriəti əldə bəhanə edib biçarə avam camaatı öz qərəz və mərəzimizə alət edərik.* C.Məmmədquluzadə.

**QƏRƏZ**[2] *ara s*. [*ər.*] Xülasə, sözün qısası (bəzən "ki" bağlayıcısı ilə birlikdə). *Qərəz, Koroğlu çobanın paltarını alıb geyindi, çomağını da əlinə alıb obaya tərəf yollandı.* "Koroğlu". *Qərəz, sözüm orada deyil, sözüm oradadır ki, doğrudan uşaqlıq bir gözəl nemət imiş ki, əldən çıxdı*. C.Məmmədquluzadə. [Möhlətov] *qərəz ki, öz aləmində sevmək, sevişmək .. üçün nə lazımdısa, nə mümkündüsə hamısını eləmişdi*. Mir Cəlal.

**QƏRƏZKAR** *sif.* [*ər.* qərəz və *fars*. ...kar] b a x **qərəzli**. *Qərəzkar oxudu axşamımızın; Uzaq məqsədini dan yerimizdən*. B.Vahabzadə.

**QƏRƏZKARANƏ** *zərf* [*ər.* qərəz və *fars*. ...karanə] Qərəzlə, qərəzkarlıqla, bədxahlıqla, pis məqsədlə, pis niyyətlə. *İnsan dünyaya gəlir, təbiətin xain dayələri əlində qərəzkaranə məqsədlə nəvaziş olunur, bəslənilir*. C.Cabbarlı.

**QƏRƏZKARLIQ** b a x **qərəzlilik**. *Pənahəli bəy Nadir şahın ona olan qorxunc baxışlarından və qərəzkarlıqla* (z.) *etdiyi rəftarından başa düşdü ki, o mütləq belə bir .. cavanın kökünü kəsməkdə səhlənkarlıq etməyəcəkdir.* Mirzə Adıgözəl bəy.

**QƏRƏZLİ** *sif.* Qərəzi, ədavəti olan, gizli bir məqsəd və niyyəti olan; bədxah. [Hikmət İsfahani:] *Qərəzli dost biqərəz düşməndən pisdir...* M.İbrahimov. *Bu qərəzli, qərəzli vuruşmalarda; Sizdən soruşuram, ədalət hanı*? B.Vahabzadə.

**QƏRƏZLİK** *is. dan.* bax **qərəz**[1] 2-ci mənada.

**QƏRƏZLİLİK** *is.* Qərəzi olma, biri haqqında pis fikir və niyyət bəsləmə; bədxahlıq. *Qərəzliliklə* (z.) *iş görmək.*

**QƏRƏZSİZ** *sif.* Qərəzi, gizli məqsədi, pis niyyəti olmayan; səmimi. *Qərəzsiz adam. Qərəzsiz yardım*.

**QƏRƏZSİZLİK** *is.* Heç bir qərəzi, pis fikir və niyyəti olmama.

**QƏRİB** *sif.* [*ər.*] 1. Yad yerdə olan, qürbətdə yaşayan, özgə yerli, gəlmə. *Dünən gördüm ki, qərib osmanlılar qaçırlar konsulxanaya ki, təzə sultanın taxta çıxmasından yana konsula* "*mübarək olsun*" *desinlər*. C.Məmmədquluzadə. *Deyirlər ki, qərib yolçu bu yerlərdən keçəndə; Diksinərmiş yırtıcıdan, vəhşi heyvan səsindən.* R.Rza. *Bu yad, qərib ozanın ağzından öz adını eşidəndə Banuçiçək diksindi*. M.Rzaquluzadə.

2. Yad, özgə, tanış olmayan. *Yox, qardaşım, bizi dartıb qərib vilayətə apardığın yetər, daha bunu verməyərəm, – deyə anam dayımın təklifini rədd etdi*. S.S.Axundov.

3. *İs. mənasında.* Qərib adam, gəlmə, başqa yerli. *Lütfünlə mən qəribə, ey mah, qıl nəzərə*. Heyran xanım. *Fəhlə qardaş, nə tikilir bu qum çölündə? – Qəribmisən, nəsən, oğul? Şəhər salırıq*. Ə.Cəmil.

4. Kimsəsiz, biçarə, yazıq, zavallı.

5. B a x **qəribə**. *Burada gecələrin qərib səsi var; Könlümün incə bir kəmançəsi var.* S.Vurğun. [Müəllim] *Əsədlə Mahmud əmiyə izahat vermək üçün bu əcib və qərib əlamətə fənni və elmi bir məna arayıb onları və həm də özünü ovutmaq fikrinə düşdü.* B.Talıblı. *Fərman görkəmi və qərib vəziyyəti ilə bu gənclərin diqqətini özünə cəlb etdi.* Ə.Sadıq.

6. *məc.* Həzin, hüzn gətirən. *Qərib qış axşamları yolları qar basanda; At sürüb bir şenliyə, gecələdim Muğanda.* Ə.Cəmil.

**qərib-qərib** *zərf* Yazıq-yazıq, məzlum-məzlum, həzin-həzin, yanıqlı-yanıqlı. *Qərib-qərib durduq biganələr tək; Soyuq-soyuq baxdıq divanələr tək.* M.P.Vaqif. *İnəklərin qərib-qərib mələməsi naxırın kəndə dolduğunu, günün batdığını xəbər verirdi.* M.İbrahimov.

**QƏRİBANƏ** *zərf* [*ər.* qərib və *fars*. ...anə] Qərib kimi; itaətlə, həqiranə. *Mən öyrənmişəm tənha, qəribanə dərd-qüssə çəkməyə, Allah kərimdir, get!* N.Vəzirov.

**QƏRİBÇİLİK: qəribçiliyini çəkmək** – çox darıxmaq, həsrətini çəkmək. *Səttarxan Əli dayını düşünür, onun və başqa dostlarının qəribçiliyini çəkirdi.* P.Makulu.

**QƏRİBƏ** *sif.* [*ər.*] 1. Eşidilməmiş, görünməmiş, təəccüblü, qeyri-adi, çox maraqlı. *Qəribə söz. Qəribə əhvalat.* – [Vəzir:] *Mən istəyirəm ki, bayramda bir qəribə mintənə Şölə xanıma bağışlayım.* M.F.Axundzadə. *Yusif əmi hər gecə bizə şirin-şirin nağıllar danışır, çox qəribə tapmacalar deyirdi.* A.Şaiq. *Bu köpəkdə qəribə bir hal vardı. Hər kəs ki, Piri kişiyə düşmən idi, köpək onu sevməyib yaxına qoymazdı.* S.S.Axundov.

2. Son dərəcə, olduqca, valeh edəcək dərəcədə. *Sultanüşşüəra .. üzünü yoldaşlarına çevirib: – Qəribə gözəldir, bimisil qızdır, doğrudan, qəzəl deməyə layiqdir, – deyib yola düşdü*. M.S.Ordubadi.

3. **Qəribədir** şəklində – çox təəccüblüdür, çox maraqlıdır. *Çox qəribədir, növbə Fərmana çatanda o, nədənsə ürəyinin döyündüyünü hiss etdi*. Ə.Sadıq.

**QƏRİBƏLƏŞMƏ** "Qəribələşmək"dən *f.is.*

**QƏRİBƏLƏŞMƏK** *f.* Başqalaşmaq, getdikcə ayrı cür olmaq, dəyişmək. *Sən də get-gedə qəribələşirsən, ay Qəhrəman!* S.Rəhimov.

**QƏRİBƏLİK** *is.* Qəribə şeyin halı; təəccüblülük.

**QƏRİB-QÜRƏBA** *top.* [*ər.*] Qərib adamlar, özgə yerdən gəlmiş adamlar. *..Axşamüstü buyur bazara, ramazanlıqdır, gör necə adamın dişləri tökülür, ələlxüsus qərib-qürəbanın.* N.Vəzirov.

**QƏRİBLƏMƏ** "Qəribləmək"dən *f.is.*

**QƏRİBLƏMƏK** *f.* Qəribliyə düşmək, özünü qərib hiss etmək; yurdunu, vətənini arzulamaq, qəribsəmək.

**QƏRİBLƏŞMƏ** "Qəribləşmək"dən *f.is.*

**QƏRİBLƏŞMƏK** *f.* Qərib olmaq, getdikcə yad olmaq, uzaqlaşmaq.

**QƏRİBLİK** *is.* 1. Yad yerdə olan, qürbətdə olan adamın halı. // Qürbət. *Qəribklikdə yaşamaq. Qəriblikdə ölmək. – Qəriblik ixtiyar etməz, kimin kim, yarı yar olsa.* Kişvəri. *Qəriblikdə yada düşər, yanaram; Aşna, yoldaş, yar, müsahib, ellər, hey.* M.V.Vidadi. *Durnalar ötüb gedir; Qəriblikdən qürbətə; İkisi bir, üçü bir.* R.Rza.

2. Yazıqlıq, zavallılıq, adamsızlıq, kimsəsizlik, təklik. // Hüzn, ələm, kədər, qəmginlik. *Onun çıraq kimi yanan gözlərində bir qüssə, bir qəriblik vardı.* M.İbrahimov. *Çoxdandır tökülmüş sarı yarpaqlar; Günəşdə bu axşam bir qəriblik var.* N.Rəfibəyli.

◊ **Qəribliyə düşmək** – qulaqardına vurulmaq, sayılmamaq, əhəmiyyət verilməmək. *Sözlərinin bu cür qəribliyə düşdüyünü görüb pərt olan Güləlioğlu .. katiblə vidalaşmadan haraya isə getdi.* M.Hüseyn. **Qəribliyə salmaq** – əhəmiyyət verməmək, qulaq asmamaq, etina etməmək, saymamaq. *Qəzetimizdə* “*Ordan-burdan*” *yazan* “*Filankəs*”*in zarafatyana yazdığı sözləri hər halda qəribliyə salmaq olmaz.* F.Köçərli. *Bəşir müəllimin sözünü qəribliyə salmağa haqqımız yoxdur.* Mir Cəlal.

**QƏRİBNƏVAZ** [*ər.* qərib və *fars.* ...nəvaz] Qəribləri himayə edən, onlara kömək edən, hörmət edən.

**QƏRİBNƏVAZLIQ** *is.* Qəribləri himayə və onlara kömək etmə, hörmət etmə. *Sən bizi tamam yaddan çıxardın, axı qəribnəvazlığın qaydası belə olmaz.* M.F.Axundzadə.

**QƏRİBSƏMƏ** “Qəribsəmək”dən *f.is.* *Bəhram özünə bəlli olmayan bir qəribsəmə duydu.* Ə.Vəliyev.

**QƏRİBSƏMƏK** *f.* Özünü bir yerdə tək və kimsəsiz görüb qəmgin olmaq, qəriblik hiss etmək, darıxmaq. *Bu dadlı söhbətlərin içində belə yenə də ağsaqqal həkim öz ailəsi üçün çox bərk qəribsəyir, öz Mehriban xanımı üçün bərk darıxırdı.* S.Rəhimov. *Mən tanıdığım bir nəfər də yox idi. Ona görə bir küncdə qəribsəyirdim.* Mir Cəlal. *Mən də sizsiz qəribsədim, uçmaq istər ruhum daha.* Ə.Cavad.

**QƏRİNƏ** *is.* [*ər.*] Əslində 33 illik bir dövr olub, əsr mənasında işlənir. *Qərinələrlə məst olub cəhalətə uyuduq! Nə gördük? Nə qazandıq?* C.Məmmədquluzadə. *Elə bir cahan ki, onun hər anı; Mənalı görünür bir qərinədən.* S.Vurğun. *Qərinələr yolçusu – ay göyləri dolanar; Göy üzünün şamları sübhəcən sönər, yanar.* Ə.Cəmil.

**QƏRQ** [*ər.*] Adətən “etmək”, “olmaq” köməkçi feilləri ilə birgə işlənir. ☐ **Qərq etmək** – 1) batırmaq (suda). *Düşmən vəziyyətin çıxılmazlığını görüb, gəmilərini qərq etdi;* 2) boğmaq (suda). *..Bir də gördüm dəryanın suyu qalxır yuxarı, az qalır məni qərq edə.* C.Məmmədquluzadə; 3) *məc.* məhv etmək. *Bu müsibət müharibə qızışdırıcılarını hökmən boğub qərq edəcəkdir.* (Qəzetlərdən); 4) *məc.* bir şeyin çoxluğunu ifadə edir. [Çimnaz:] *..Bəsdirin, qızlar, nə onu çiçəyə qərq edirsiniz.* Ə.Məmmədxanlı. [Kərim:] *Bizə elə bir lampa lazımdır ki, günəş kimi parlasın, aləmi öz işığına qərq etsin.* Ə.Sadıq; 5) batırmaq, bulamaq. *Ey həmdəmim, səni qana qərq elər; Gəl tərpətmə yaralanmış könlümü.* M.V.Vidadi. *Çeynədilər, dişlədilər, diddilər; Bir-birini al-qana qərq etdilər.* A.Səhhət. **Qərq olmaq** – 1) batmaq. *Gəmiçi özünü itirsə əgər; Tufanlar içində qərq olub gedər.* S.Vurğun. *Gəminin dalınca üzmək istədi, bacarmayıb suya qərq oldu.* M.Hüseyn; 2) boğulmaq (suda). *Batmış gəmidəki yolçuların hamısı qərq oldu. – Ciğato çayı minlərlə qərq olmuş insan meyitləri*(*ni*) *.. axıdıb Urmu gölünə aparırdı.* M.S.Ordubadi; 3) adətən tərkiblərdə işlənib bir şeyin çoxluğunu, şiddətini, dərinliyini və s.-ni bildirir. *Gözümün yaşına qərq oldu tənim; Bu hal ilə işim müşküldür mənim.* Q.Zakir. *Sabir kimi qərq oldu gözüm yaşına cismim.* M.Ə.Sabir. *Keçmişdi keçən şəb gecədən bir neçə saət; Məhtab ilə olmuşdu cahan qərqi-lətafət.* A.Səhhət. *Sonra səs-səmir kəsildi, kənd böyük bir sükuta qərq oldu.* Çəmənzəminli. *Afaqın solğun üzü göz yaşları içərisində qərq oldu.* Ə.Məmmədxanlı.

**QƏRYƏ** *is.* [*ər.*] *köhn.* Kənd. *Yollar xarab, qəryələr viran, .. qəbiristanlar küçələrin içində havanın kəsafətinə bais.* M.F.Axundzadə. *İki gün yol gedib yetişdik məşhur Kəleybər qəryəsinə..* C.Məmmədquluzadə.

*Eşidirdim mən atların səsini; Qəryəyə axşam üstü dönməsini*. A.Səhhət. [Usta:] *Bəli, oğlum, görünür ki, bütün ətraf qəryələri tapdaya-tapdaya məxsusən mənim yanıma gəlmisən*. S.Rəhimov.

**QƏRZ** *is*. [*ər*.] *köhn*. Borc. [Rüstəm] *axır ayağa qalxıb, Əkbərdən üç günün müddətinə yüz manat qərz alıb yola düşdü*. Ə.Haqverdiyev.

**QƏRZƏK** *is. məh*. Təzə qoz, fındıq kimi meyvələrin dəydikcə yarılıb tökülən yumşaq üst qabığı. *Yetişmiş qozaların qərzəkləri saralır və ağzı açılaraq içərisindəki qozalar yerə tökülməyə başlayır*. Axundzadə.

**QƏRZƏKLƏMƏK** *f*. Qərzəyini soymaq (b a x **qərzək**).

**QƏRZƏKLƏNMƏK** *f*. Qərzəyi soyulmaq (b a x **qərzək**). *Qərzəklənmiş qozu qaxsımamaq üçün günün qabağına sərirlər*.

**QƏRZƏKLİ** *sif*. Qərzəyi olan, üstündə yaşıl qabıq olan (təzə qoz, fındıq və s.). *Badam qərzəkli meyvə bitkiləri qrupuna daxildir*.

**QƏRZƏN** *zərf* [*ər*.] *köhn*. Borc olaraq.

**QƏSABƏ** *is*. Köhnə zamanlarda qadın paltarının yuxarısından aşağıya doğru uzanan bəzəkli yaxalıq. *Ətəkliyi altun, qəsabəsi zər; Çəhrayı çarqat qəddə bərabər*. M.P.Vaqif.

**QƏSB** *is*. [*ər*.] Zorla alma, qapma, zəbt etmə, tutma, zorla mənimsəmə. ☐ **Qəsb etmək** – zorla almaq, tutmaq, tapmaq, mənimsəmək, zəbt etmək. *..Hətta bütün şimal əyalətlərini qəsb etmək istədikləri qəzetlərdə faş olunmalıdır*. M.İbrahimov. **Qəsb olunmaq** – zorla alınmaq, zorla tutulmaq, zəbt edilmək. *..İşçilər xüsusi mülklərin zəhmətkeşlərə təqsim olunmasını tələb edirlər və belə olan surətdə mülk sahibləri razı olmayacaqlar və onlardan alınan mülklər qəsb olunacaqlar*. C.Məmmədquluzadə.

**QƏSBKAR** *is*. [*ər*. qəsb və *fars*. ...kar] Özgənin malını, mülkünü, torpağını və s.-ni zorla tutan, əlinə keçirən, qəsb edən adam. *Xalqın yadelli qəsbkarlara qarşı mübarizəsi* "*Koroğlu*", "*Qaçaq Nəbi*" *kimi dastan və mahnılarda tərənnüm edilir. – Talançılar boğazından çəkilmişdir bu gün dara; Nifrət olsun, lənət olsun tarixlərdə qəsbkara*. M.Dilbazi.

**QƏSBKARLIQ** *is*. Özgənin malını, mülkünü, torpağını və s.-ni zorla tutma, əlinə keçirmə, qəsb etmə. *Ərəb hakimi Haşimin dövründə Dərbənd əhalisi naçar qalıb alver və qəsbkarlıqla məşğul oldu*. A.Bakıxanov.

**QƏSD** *is*. [*ər*.] 1. Niyyət, məqsəd, məram. *Xudayar bəyin qəsdi Zeynəbin və səqirlərin var-yoxuna .. sahib olub, Zeynəbi çölə ötürmək idi*. C.Məmmədquluzadə. *Buraya gəlməkdən qəsdim səndən kömək istəməkdir*. Ə.Haqverdiyev. *Göyərçin onu görüncə əsdi; Bildi ki, nədir tərlanın qəsdi*. M.Seyidzadə. // *ilə* qoşması, yaxud *-lə* şəkilçisi ilə – 1) ...məqsədi ilə, ...niyyəti ilə, ...üçün. *Ayrım qızı .. Kərim babaya acı dərs vermək qəsdi ilə yumrubaşlı iri çomağı götürüb özünü naxıra yetirmişdi*. A.Şaiq; 2) qəsdən, müəyyən məqsədlə. *Qəsd ilə nihan edib kitabın; Həddən aşırırdı iztirabın*. Füzuli. *Burada Araz və Culfa sözlərini mən qəsdlə yazıram*. C.Məmmədquluzadə. ☐ **Qəsd etmək** – 1) niyyətində tutmaq, fikrində tutmaq, nəzərində tutmaq; 2) niyyətində olduğu şeyi həyata keçirməyə təşəbbüs etmək. *O ki öz varını insana vermiş; Ona qəsd eləmək cinayət olar*. B.Vahabzadə.

2. B a x **qərəz**[1] 2-ci mənada. *Bu işdə heç bir qəsd olmamışdır*.

3. Birini öldürmək, yaralamaq, yaxud zərər vermək üçün edilən təşəbbüs, görülən iş; sui-qəsd. ☐ **Qəsdinə durmaq (girmək)** – birinin ölümünə, məhvinə, yaxud bədbəxtliyinə çalışmaq. *Heç bilməzəm nədir günahım mənim; Durubdur qəsdimə cəlladın sənin*. M.P.Vaqif. *Zalım cəllad nə giribdi qəsdimə; Xəbər verin övladıma, dostuma*. Aşıq Ələsgər. **Canına (həyatına) qəsd etmək** – birini öldürməyə təşəbbüs etmək; // məc. mənada. *Gözünü düzüb süzürsən, dilü canə qəsd edirsən*. Nəsimi. *Qəsd eləmişdin nə üçün canına; Olmuş idin təşnə onun qanına?* A.Səhhət.

4. **Qəsdindən** şəklində – ürəyindən, qəlbindən, xəyalından, fikrindən. *Hər kəsin qəsdindən aşıqlıq keçər; Qarşı gəlsin, edək cəngi qıjhaqıj*. Aşıq Ələsgər.

◊ **Şirin cana qəsd eləmək** *zar*. – özünə əziyyət, əzab vermək (çox işləməklə, çalışmaqla və s. ilə). *Gülxar Zal qızı, siz şirin cana qəsd eləmişsiniz. Nə tikirsiniz?* Ə.Vəliyev.

**QƏSDÇİ** *is.* Qəsd hazırlayan, qəsddə iştirak edən, terrorçu.

**QƏSDÇİLİK** *is.* Terrorçuluq, sui-qəsd düzəltmə.

**QƏSDƏN** *zərf* [*ər.*] Bilərək, bilə-bilə, müəyyən məqsədlə. *Qəsdən bu sözü söylədi. Mən qəsdən belə dedim. – Qəsdən unudurdu dərsin ol zar; Leyliyə deyirdi: ey vəfadar!* Füzuli. [Əsgər:] *Mən də qəsdən demədim ki, qoy axıra kimi qızı sınayım.* Ü.Hacıbəyov. *Ceyran oturub oğlu ilə əylənməyə, gülməyə başlayır. Qəsdən özünü nəşəli göstərir.* S.Hüseyn. *O, yelqanadlı atını qəsdən çapmırdı ki, ovu atasının gözü önündə ovlasın.* M.Rzaquluzadə.

**QƏSD-QƏRƏZ** *is.* [*ər.*] Düşmənçilik, ədavət, qərəz. [Odabaşı:] *..Xalqın eşşəyini oğurlayıb gətirmisən, qatmısan mənim karvansarama. Niyə görə? Mənimlə qəsd-qərəzin var?* C.Məmmədquluzadə. [Dərviş:] *Bu sözlərdən mətləb nədir?.. Mənə nə qəsd-qərəzin var?* A.Divanbəyoğlu.

**QƏSDSİZ** *zərf* Heç bir qəsdi-qərəzi, pis niyyəti olmadan. *O, bu sözü qəsdsiz söylədi.*

**QƏSƏBƏ** *is.* [*ər.*] Şəhər tipli yaşayış məntəqəsi. *Fəhlə qəsəbəsi. – Heç bilirsinizmi ki, dünyada Ağdam qəsəbəsi də var?* C.Məmmədquluzadə. *Küçələrdə arabaçılar, suçular və qeyri qəsəbə əhli o yan-bu yana yeriməkdə idi.* S.M.Qənizadə. *Dənizdən əsən xəfif meh fəhlə qəsəbəsinə xoş bir sərinlik gətirirdi.* M.Hüseyn.

**QƏSƏBƏCİK** *is.* Kiçik qəsəbə.

**QƏSƏBƏLİ** *is.* Qəsəbə əhli, qəsəbədə yaşayan adam, qəsəbə əhalisindən olan adam.

**QƏSƏBƏVARİ** *sif.* Qəsəbə kimi, qəsəbəyə oxşayan. *Şose yolunun kənarında qəsəbəvari bir yer vardır.*

**QƏSƏM** *is.* [*ər.*] And. *İmanına qəsəmlə çapırsan camaəti; Quldurçuluq tüfəngimidir dinin, ey əmu?* M.Ə.Sabir. ☐ **Qəsəm etmək** – and içmək. *İstəyirsən yüz min dəfə and iç, qəsəm eylə, heç vaxt sənin sözünə inanmayacaq.* C.Məmmədquluzadə. *Bu barədə anamın qəbrinə də qəsəm etmişəm..* M.S.Ordubadi. **Qəsəm olsun!** – and olsun! *Qəsəm olsun! Bu meydandan dönmərəm; Axır suda sınar suyun səhəngi.* "Koroğlu". *Qəsəm olsun gələcəyə, yurdum ana torpağa!* M.Rahim. // Cümlədə xəbər yerində – and olsun. *Aşiqəm, aşiqəm, nigarə qəsəm; O siyah çeşmi-pürxumarə qəsəm.* S.Ə.Şirvani. *And olsun vətənə, sənin gözünə; Anamın o təmiz südünə qəsəm.* R.Rza.

**QƏSƏMNAMƏ** *is.* [*ər.* qəsəm və *fars.* ...namə] *din.* And vərəqəsi, and içmək haqqında kağız. *Əgər həmin qəsəmnamə olmasaydı, hər ayinə tərəkəmənin .. atı sənin üçün böyük cəzaya, rüsvayçılığa və hətta böyük bir bədnamlığa bais olacaq idi.* S.Rəhimov.

**QƏSİDƏ** *is.* [*ər.*] Böyük bir şəxsi və ya tarixi bir hadisəni mədh və tərif edən, adətən təntənəli, uzun lirik şeir. *Gəh tərzi-qəsidə eylərəm saz; Şəhbazım olub büləndpərvaz.* Füzuli. [Xaqani:] *Yazsaydım qəsidə əgər hər zaman; Şərqə tanınmazdı sevimli Şirvan.* M.Rahim. *Bazarda qəsidə oxuya-oxuya bir dərviş və yanında bir adam gəldi.* Ə.Abasov. // Tərifnamə. *..Ya da "Məzhər" qəzetinin sahibi Kamil Əfəndi kimi gərək canişin həzrətlərinə birinci nömrəmizdə qəsidə oxuyaq ki, hökumət yanında hörmətimiz olsun.* C.Məmmədquluzadə.

**QƏSİDƏÇİ** *is. köhn.* Qəsidə söyləyən, qəsidə yazan. *Qəsidəçi şairlər. – Ravilər, rəmmallar, qəsidəçilər; Axışıb gəldilər hey birər-birər.* Şəhriyar.

**QƏSİDƏÇİLİK** *is. köhn.* Qəsidə söyləmək peşəsi, qəsidə yazmaq sənəti; qəsidə yazmaqla məşğul olma. *Qədim Şərq şairlərinin bir çoxu qəsidəçiliklə məşğul olmuşdur.*

**QƏSİDƏXAN** *is.* [*ər.* qəsidə və *fars.* ...xan] *köhn.* Qəsidə oxuyan.

**QƏSİDƏXANLIQ** *is. köhn.* Qəsidəxanın işi, peşəsi.

**QƏSİDƏYAZAN** *is. köhn.* Qəsidə müəllifi, qəsidə yazmaqla məşğul olan şair.

**QƏSR** *is.* [*ər.*] İmarət, padşah sarayı. *Şah Abbas günortadan üç saat keçmiş qəsrdə öz məhbubəsi Səlimə Xatun ilə oturub söhbətə məşğul idi.* M.F.Axundzadə. *Fəxrəddin Xüld qəsrinin yanına getmək üçün Əmin qəsrindən aşağı düşdü.* M.S.Ordubadi. *Yasavullar gecə yarısı qəsrin yanında, qapının ağzında şübhəli bir adam yaxaladılar.* M.Rzaquluzadə.

**QƏSSAB** *is.* [*ər.*] Qoyun, mal və s. kəsib ətini satmaqla məşğul olan adam. *Bir dəfə*

*bunu eşitdim ki, qonşu Məşədi Məmmədəli qızını verib qəssab Şamilə.* C.Məmmədquluzadə. *Bığı xınalı, dəvərəgöz bir qəssab kötüyün üstündə ət doğrayırdı.* Mir Cəlal.

**QƏSSABBAŞI** *is. köhn.* Baş qəssab. *Əti də Şeyx Şəban hər qəssabdan almazdı. Qəssabbaşı İmaməli ilə müştəri idi.* Ə.Haqverdiyev.

**QƏSSABXANA** *is.* [*ər.* qəssab və *fars.* ...xanə] *köhn.* Böyük qəssab dükanı, ət satılan yer.

**QƏSSABLIQ** *is.* Qəssab sənəti, peşəsi. [Afşin:] *Ya əmirəlmömin, qəssablıq nə böyük hünər imiş ki, sən İshaq ibn İbrahimi mükafatlandırırsan!* Ə.Məmmədxanlı.

**QƏSVƏT** *is.* [*ər.*] Hüzn, qəm, kədər, ürək sıxıntısı. [Külək] *yarıqaranlıq komanda məntəqəsini boğaz acışdıran hislə bərabər, ürəksıxan soyuq bir qəsvətlə doldurdu.* Ə.Əbülhəsən.

**QƏŞƏNG** *sif.* [*fars.*] Görünüşcə çox gözəl, bəzəkli, insanda bədii təsir oyadan. *Qəşəng ev. Qəşəng mənzərə. Qəşəng paltar. – Uzaqda bir alaçıq görünür, alaçıqdan on qədəm kənar kolun dalısında Sona xanım qəşəng səfər paltarını geymiş, .. o yan-bu yana baxır.* M.F.Axundzadə. *Göy üzündə bir qəşəng; Tağ görünür yeddi rəng.* A.Səhhət. [Hüseyn] *ikimərtəbə qəşəng bir evin qapısını qorxa-qorxa döydü.* S.Rəhman. // Gözəl, zərif, incə, lətif, məlahətli. *Qəşəng bədən. Qəşəng üz. Qəşəng saç. Qəşəng səs. – Başına döndüyüm, ay qəşəng pəri; Adətdir, dərərlər yaz bənövşəni.* Qurbani. *Batmış gör necə də qəşəng naxışlar vurub.* İ.Əfəndiyev. // Çox yaxşı. *Onun qəşəng üslubu var.* // Zərf mənasında. *Qəşəng oxumaq. Qəşəng geyinmək.*

**QƏŞƏNGCƏ** *sif.* Çox qəşəng, çox yaxşı, çox gözəl. *Qəşəngcə uşaq. – Aynalı şifoner, qoz ağacından tualet bu otağa .. qəşəngcə bir görkəm verirdi.* Ə.Əbülhəsən. // Zərf mənasında. *Qəşəngcə geyinmək. – ..Bunları mən çox yaxşıca görürəm, çox əcəbcə görürəm, çox qəşəngcə görürəm.* C.Məmmədquluzadə.

**QƏŞƏNGİ** *is.* [*fars.*] *mus.* Azərbaycan xalq oyun havalarından birinin adı.

**QƏŞƏNGLƏNMƏ** "Qəşənglənmək"dən *f.is.*

**QƏŞƏNGLƏNMƏK** b a x **qəşəngləşmək**.

**QƏŞƏNGLƏŞMƏ** "Qəşəngləşmək"dən *f.is.*

**QƏŞƏNGLƏŞMƏK** *f.* Daha da qəşəng olmaq, gözəlləşmək. [Qəhrəman] *ucalmış, qara saçları daha da sıxlaşmış, özü də dəyişib qəşəngləşmişdi.* S.Rəhimov.

**QƏŞƏNGLİK** *is.* Qəşəng şeyin halı; gözəllik, gözəşirinlik. [Cəmilənin] *sıx qara saçları .. sifətinə bir qəşənglik, bir yaraşıq verir.* S.Rəhimov.

**QƏŞŞ** *is.* [*ər.*] Özündən getmə, ürəyi getmə, bayılma, bayğınlıq. *Mən qorxudan bihuş olub yıxıldım; Qəşş aləmində bir tamaşa qıldım.* A.Səhhət. ◻ **Qəşş etmək (eləmək)** – 1) özündən getmək, ürəyi keçmək, bayılmaq. *..Ölünün başı dikəldi. Bunu gördükdə Molla Qasım qışqırıb qəşş etdi.* S.S.Axundov. *Xan .. Zamanın birçəklərindən yapışıb ayağının altına saldı. Nökər yerə düşüb qəşş etdi.* Çəmənzəminli; 2) həddindən artıq istəmək, bir şeyin arzusunda, həsrətində olmaq. **Qəşş olmaq** – son dərəcə ruhlanmaq, canlanmaq, ləzzət aparmaq. *Nə müqəddəs havası var .. hər an; Nəfəs aldıqda qəşş olur insan.* H.Cavid.

**QƏT** [*ər.*]: **qət etmək** – 1) kəsmək. *Qət eylə aşinalığım ondan ki, qeyridir.* Füzuli; 2) həll etmək, ayırd etmək, qurtarmaq. *Mübahisəni qət etmək. – İki saatın içində bu işi qət eləmək olar.* M.F.Axundzadə; 3) keçmək, yol getmək. *Təyyarə saatda 800 kilometr yol qət edir. – Əgər fəhlələr sürətlə gedən qatara minsəydilər, Qara daşlarla liman arasındakı məsafəni beş saata qət edə bilərdilər.* M.Hüseyn. *Məsafəni qət etmək uzun çəkdi.* Ə.Əbülhəsən; 4) qəti qərara gəlmək, qəti rəyə gəlmək, kəsdirmək. *Qət etdik ki, bu gün yola düşək.* – [Həcər xanım:] *Oğlum, Çingiz, biz qocalar qət etdik ki, səni də aparaq.* S.S.Axundov. **Qət olunmaq (edilmək)** – 1) (bəzən "**qət olmaq**" şəklində işlənir) kəsilmək. *Hacı Xəlilin səsi getdikcə zəifləşirdi, axırda nəfəs bilmərrə qət olub, dodaqları yavaş-yavaş tərpənirdi.* Ə.Haqverdiyev; 2) həll edilmək, həll olunmaq. *Axırda qət olundu ki, təhqiqat getsin.* Mir Cəlal. **Qəti-əlaqə etmək** – əlaqəsini kəsmək, aranı qırmaq. *..Xalqdan bir dəqiqə də olsa qəti-əlaqə etmək yaramaz.* M.İbrahimov. **Qəti-nəzər etmək** – üz döndərmək, əlaqəni kəsmək. **Qəti-ümid olmaq** – ümidini kəsmək,

əlini üzmək. [Qoca:] *Məndən aşan iş isə, oğlum, qəti-ümid olub bizi atıb getmə.* A.Divanbəyoğlu.

**QƏTA** [*ər.*] *köhn.* bax **qətiyyən**. *Ahim etməz heç əsər qəta sənə.* Əmani. *Məhəmməd Həsən əmi dünya malına əsla və qəta talib deyil..* C.Məmmədquluzadə.

**QƏTAR** [*ər.*] bax **qatar**[1]. *Nalan qəmi-eşqi-yardənsən; Sən dəxi bizim qətardənsən.* Füzuli.

**QƏTEDİCİ** *sif.* 1. Kəsici, qət edən. *Qətedici xətt.*

2. Həlledici, axırıncı; son. *Qətedici söz.*

**QƏTƏN** [*ər.*] *köhn.* bax **qətiyyən**. *Belə insan kimi danışmağı mən; Sanki unutmuşdum ol zaman qətən.* A.Səhhət.

**QƏTFƏ** *is.* [*ər.*] Çiməndən sonra bədəni qurulamaq üçün böyük dəsmal. *Camadarlar qətfə ilə gedirlər.* Ü.Hacıbəyov. *Xozeyinlər hamama gələndə özləri üçün qanavat boğçanın içində fitə, qətfə gətirirdilər.* H.Sarabski.

**QƏTFƏÇİ** *is.* Hamamda çimənlərə qətfə verən xidmətçi; camadar.

**QƏTİ** *sif.* və *zərf* [*ər.*] 1. Rədd edilməsi mümkün olmayan, etiraza yol verməyən; pozulmaz, möhkəm. *Qəti əmr. Qəti tapşırıq. Qəti qərar. – Sarxan xırıltılı səsi ilə kinli və qəti dedi: – Qoy öldürsünlər..* M.Hüseyn. *Sübhanverdizadə qəti bir ahəng və pıçıltı ilə:* “*Belə, ancaq belə!*” *– dedi.* S.Rəhimov.

2. Son, axırıncı, həlledici. *Qəti cavab. Onunla qəti danışmaq lazımdır. – Hüsaməddin Qətibənin sözlərinə qəti cavab vermədi.* M.S.Ordubadi. *Burlaxatun son qəti dəqiqələrin gəldiyini hiss edib, .. vəsfəgəlməz iztirablar çəkirdi.* M.Rzaquluzadə.

3. Tam yəqinliklə, tamamilə, möhkəm surətdə. *Qəti demək olar.* // Tərəddüdsüz, sarsılmaz, möhkəm. [Barxudar] *əlində paket iri və qəti addımlarla qutuya yaxınlaşanların ayaq səslərini eşidirdi.* Mir Cəlal.

4. Ən təsirli, ən şiddətli, ən kəskin, ən güclü. *Qəti tədbir görmək.*

**QƏTİFƏ** [*ər.*] bax **qətfə**. *O, qapını açıb gəldi, əlindəki qətifəni, kisəni və sabun torbasını atdı taxtın üstünə.* C.Məmmədquluzadə. *Varis əlində ağ qətifəyə sarılı bir şey içəri girdi.* A.Şaiq.

**QƏTİFƏÇİ** bax **qətfəçi**.

**QƏTİLƏŞDİRİLMƏ** “Qətiləşdirilmək”-dən *f.is.*

**QƏTİLƏŞDİRİLMƏK** *məch.* Qəti şəklə salınmaq, müəyyənləşdirilmək.

**QƏTİLƏŞDİRMƏ** “Qətiləşdirmək”dən *f.is.*

**QƏTİLƏŞDİRMƏK** *f.* 1. Qəti şəklə salmaq, müəyyənləşdirmək. *Məsələni qətiləşdirmək.*

2. Daha möhkəm, daha cəsarətli, yaxud daha təsirli etmək, ciddiləşdirmək. *..Düşmən sənin qorxaqlığını hiss edərsə, öz addımlarını daha da qətiləşdirər.* M.S.Ordubadi. *Rübabə məsələnin özünə aid olduğunu yəqin edib, səsini qətiləşdirdi: – Nə olub, ata?* Mir Cəlal.

**QƏTİLƏŞMƏK** *f.* Qəti şəklə düşmək, müəyyənləşmək.

**QƏTİLİK** *is.* bax **qətiyyət**.

**QƏTİYYƏN** *zərf* [*ər.*] Əsla, heç, tamamilə, zərrə qədər də olsa, heç bir vəchlə, heç bir vaxt. *Qətiyyən buna razı olmarıq. –* [Dərviş:] *Sən elə xəyal edirsən ki, mən buranı qətiyyən tərk edirəm?* A.Divanbəyoğlu. *Gəldiyev də anlamışdı ki, Rübabənin ürəyində qətiyyən onu sevindirən niyyət yoxdur.* Mir Cəlal.

**QƏTİYYƏT** *is.* [*ər.*] Qətilik, rədd edilməsi mümkün olmama, müəyyənlik, möhkəmlik, tərəddüdsüzlük; əzm, səbat, cəsarət. *Səlimi daxil olub yüngül bir təzimlə salam verdi. Onun simasında ağır iztirabların izi və bir qətiyyət vardı.* M.İbrahimov. *Onlar da son dəqiqələrinin gəldiyini görüb .. şərəflə ölməyi üstün tutan adamların qətiyyəti ilə vuruşurdular.* M.Rzaquluzadə. *İnad və qətiyyət ta uşaqlıqdan ..* [Hüseynin] *qəlbinə hakim olmuşdu.* S.Rəhman. *Ənvər təklifini qətiyyətlə* (z.) *dedi və oturanların üzünə baxdı.* Mir Cəlal.

**QƏTİYYƏTLİ** *sif.* İşində və ya sözündə səbatlı, əzmli, dəyanətli, möhkəm; sözündən dönməz, cəsarətli. *Qətiyyətli adam. Qətiyyətli* (z.) *hərəkət etmək.*

**QƏTİYYƏTLİLİK** *is.* İşdə və ya sözdə səbat, dayanıqlıq, möhkəmlik, dönməzlik; cəsarətlilik.

**QƏTİYYƏTSİZ** *sif.* İşində və ya sözündə möhkəm olmayan; səbatsız, cəsarətsiz, zəif

iradəli, bir fikirdə qalmayan, mütərəddid. *Qətiyyətsiz adam. – Firidun qətiyyətsiz və qeyri-müəyyən istəklərin dumanlatdığı gözlərini ona çevirdi.* M.İbrahimov.

**QƏTİYYƏTSİZLİK** *is.* İşdə və ya sözdə səbatsızlıq, mütərəddidlik, iradə zəifliyi.

**QƏTL** *is.* [*ər.*] 1. Öldürmə, öldürülmə. *Dilbər əlində aşiqin qətli nədən həram ola; Aşiqə çün həlal edər vəslini qan bahasına.* Nəsimi. *Mənə deyirlər ki, filankəs babidir; yəni mürtəddir. Mən də bilirəm ki, onun qətli vacibdir.* C.Məmmədquluzadə. *Zamanovun qətli məsələsi getdikcə Dəmirovu hiddətləndirirdi.* S.Rəhimov. ☐ **Qətl etmək, qətlə yetirmək** – öldürmək. **Qətlə yetişmək** – öldürülmək. *..Məşhur yunan tarix yazanı Herodot .. Misirə səyahət edən zaman Misir davasında qətlə yetişən farsları məhz başlarının çanağının nazikliyi ilə tanıyıb.* C.Məmmədquluzadə. [Qayadibi kəndinin] *əhalisinin bir parası qətlə yetişib, yerdə qalanı da qaçıb dağlarda, meşələrdə gizlənmişdi.* S.S.Axundov. **Qətli-am** *köhn.* – ələ keçirilən bir ölkənin bütün əhalisinin qılıncdan keçirilməsi; kütləvi qırğın. **Qətlinə fərman (vermək)** – birinin öldürülməsi, edam olunması haqqında hökm, əmr (vermək). *Natəvan, müjdə, bu gün qətlinə fərman gətirir.* X.Natəvan. *Bu xaki-siyəhdən başımız çərxə ucaldı; Ol lalərüxun qətlimə fərmanını görcək.* S.Ə.Şirvani. *..Sünbüllər məzlum-məzlum başlarını aşağı salıb, qətlinə fərman verilmiş müqəssirlər tək cəlladları olan biçinçilərə müntəzir idilər.* Ə.Haqverdiyev.

2. *din. köhn.* Məhərrəmlikdə düzəltdikləri imamların öldürülməsi hadisəsini təmsil edən tamaşa; şəbih (bu mənada çox vaxt "qətl" şəklində işlənir). *Soyuğa və qara baxmayaraq, qətl hazırlığı görünürdü, əlvan geyimli şəbihlər bir tərəfə toplanıb, rollarını əzbərləyir.* Çəmənzəminli.

**QƏTLGAH** *is.* [*ər.* qətl, *fars.* ...gah] Adam öldürülən yer. *Şah bağı indi həqiqi bir sallaqxana, qətlgah və işgəncə ocağını xatırladırdı.* P.Makulu. // *məc.* Müharibə meydanı.

**QƏTL-QARƏT** *is.* [*ər.*] Adam öldürməklə müşayiət edilən qarət, soyğunçuluq. *Biz yalnız Təbrizdə qətl-qarətin qarşısını almaq üçün deyil, lazım görüldüyü zaman Təbrizə daxil olan qüvvətin tərk-silah olunması üçün də hazırlıq görmüşdük.* M.S.Ordubadi. [Sərdar:] *Şəhərdə tez-tez böyük qətl-qarətə yol verilir.* P.Makulu.

**QƏTNAMƏ** *is.* [*ər.* qət və *fars.* ...namə] bax **qərar**[1] 1-ci mənada. *İclasın qətnaməsi. Qətnamə yazmaq. – Qədirin iştirak etdiyi elə bir iclas yox idi ki, protokolun ayağında qətnaməyə zidd gedən olmasın.* Mir Cəlal.

**QƏTRAN** [*ər.*] bax **qatran**. *Kaşanələr ağaların, qazma bizim, viran bizim; Eyş onların, nuş onların, zəhər bizim, qətran bizim.* M.Müşfiq.

**QƏTRƏ** *is.* [*ər.*] Damcı. *Otuz-qırx il bundan irəli bir müsəlman ki, bir rus məclisinə düşərdi, öldürsəydin də bir qətrə də içki dilinə vurmazdı.* C.Məmmədquluzadə. *Artıq fəvvarədən sıçrayan qətrələr şəbnəm kimi onun* [Dilşadın] *incə yanaqlarına düşdü.* M.S.Ordubadi. [Azad Ulduza:] *Qayıdarkən səni müdafiə etdim, – deyə bilmək üçün mən son qətrə qanımı belə əsirgəməyəcəyəm.* Ə.Məmmədxanlı.

**QƏTRƏBƏQƏTRƏ** bax **qətrə-qətrə**. // Bir-bir. *Vəzirləriniz əlimə düşsəydilər, sözləri qətrəbəqətrə düzərdim, qardaşlarım, ərz edərdim cənaba!* N.Vəzirov.

**qətrə-qətrə** *zərf* Damcı-damcı. *Qətrə-qətrə saçılır didələrimdən qanlar.* Füzuli. *Çöhreyi-alında qətrə-qətrə yaş; Sanasan gülzara şəbnəm oturmuş.* Q.Zakir. *Firaqi-ləliləbindən o sərvi-lalərüxun; Qəmində gözdən axan qətrə-qətrə qanı yazım.* S.Ə.Şirvani.

**QƏVAİD** *is.* [*ər.* "qaidə" söz. cəmi] *köhn.* Qaydalar, üsullar. *Bu bilik sayəsində öz Şərq musiqimizin qəvaidini daha tez .. dərk etmək və binaənileyh tərəqqisinə də daha artıq kömək etmək olar.* Ü.Hacıbəyov.

**QƏVİ** *sif.* [*ər.*] Qüvvətli, güclü, möhkəm. *Beşinci tühaf "Sofi Hüseyn" adı ilə məşhur uzunboylu, ağ uzun saqqallı, qəvi heykəl bir kişi idi.* Ə.Haqverdiyev. *İndi* [Toğrulun] *qəvi əzələləri təpədən dırnağa kimi qorxunc bir əsəbilik ilə titrəyirdi.* H.Nəzərli. *Əgər mən olmasaydım, məsul cəbhəmdə qəvi; O zaman bu ölkədə nəyə gərəkdim, nəyə?* S.Rüstəm.

**QƏVVAS** *is.* [*ər.*] *köhn.* Batmış şeyləri və s. çıxarmaq üçün dənizin dibinə dalıb çıxan

üzgüçü; dalğıc. // Klassik şeirdə və folklorda məcazi mənada işlənmişdir. *Ayrılıq gölündə, qəm dəryasında; Təzə qəvvas olub üzən necoldu?* (Qoşma). *Atı minmişəm gəzməyə; Düşmən bağrını əzməyə; Tona çayını üzməyə; Qırat bir qəvvas olaydı.* "Koroğlu". *Əgər qəvvas isən, üz arasına; Bir gör axır ondan gözlər, nə gözlər!* Nəbati. *Şayəd götürəm damənə ol dürri-yetimi; Qəvvasə dönüb eşqlə dəryalərə düşdüm*. S.Ə.Şirvani.

**QƏYUR** *sif.* [*ər.*] Qeyrətli, qeyrət çəkən, qeyrətkeş, çalışqan. *Doğrudan da, Aslan qayət qəyur, çalışqan bir uşaq idi.* C.Cabbarlı.

**QƏYYUM** *is.* [*ər.*] *hüq*. Həddi-büluğa çatmamış uşaqlara, yaxud ruhi xəstəlik üzündən öz işlərini idarə etməyə qabil olmayan şəxslərə və onların mal və mülkünə nəzarət edən adam. [Ağa Mərdan:] *O vaxtdan mən ona* [Zeynəbə] *özümü çox asanlıqla qəyyum edərəm*. M.F.Axundzadə. [Mayor:] *..Hacı olub dəli, dəliyə gərək qəyyum tikilə, .. mən onu gözləyə bilmərəm.* N.Vəzirov. *Bu yetimlərə qəyyum olmağı özünə peşə qayırmışdı.* Ə.Haqverdiyev. // *məc.* Vəkil. *Uşaq mənimdir baba, dəxli nədir sizlərə? Kim sizi qəyyum edib, hökm edəsiz bizlərə?* M.Ə.Sabir.

**QƏYYUMÇULUQ** *is.* Özünü qəyyum kimi göstərmə meyli, himayəçilik (mənfi mənada).

**QƏYYUMLUQ** *is.* Qəyyum vəzifəsi, qəyyum olma. *Qəyyumluq etmək*. – [Hacı Fərəc:] *Ola bilərmi zəhmət çəkib Ziynət xanımı çağırasınız gəlsin bura, çünki qəyyumluğa dair çox vacib işlər var*. N.Vəzirov. // Himayəçilik, himayə. *Məsmənin həyatının üçüncü səhifəsi öz baldızının qəyyumluğundan çıxdığı tarixdən başlayır*. S.Hüseyn. // *məc.* Vəkillik. [Oqtay:] *İnsan könlü kimsənin qəyyumluğunu qəbul etməz*. C.Cabbarlı.

**QƏZA¹** *is.* [*ər.*] 1. Bədbəxt hadisə, fəlakət. *Dəmiryol qəzası. Gəmi qəzası. Tramvay qəzası. Qəzaya uğramaq. – Keşlə yaxınlığında qatarımız dayanmağa məcbur oldu; irəlidəki qatar qəzaya uğramışdı*. S.Hüseyn. // İşlərkən sınma, xarab olma. *Qazıma zamanı əyri quyu, qazıma kəmərinin daha gərgin şəraitdə fırlanması nəticəsində boruların qəzaya uğramasına və daha tez sıradan çıxmasına səbəb olur*. Quliyev.

2. Qəziyyə, gözlənilməz hadisə, vaqiə, əhvalat. *Əgər bir kəsin belə bir qəza başına gəlsə, durmuyub gəlsin mənim yanıma.* C.Məmmədquluzadə.

3. Qismət, tale, müqəddərat, qədər. *Vəslü firaqə vasitə çünki qədərdir, ey könül! Cəhdilə kimsə qadirin mən eləməz qəzasını*. Nəsimi. [Xidmətçilər:] *Qəzanın təqdirindən, usta Yusif, bu gün sən bizim padşahımızsan*. M.F.Axundzadə. *Fəda o qamətə kim, qəza nə xoş çəkmiş*. X.Natəvan. *Zəmanədə bu cəfalar mənə qəzadəndir*. S.Ə.Şirvani.

**QƏZA²** *is.* [*ər.*] *tar*. 1917-ci il rus inqilabından qabaq quberniya və ya başqa böyük inzibati-ərazi vahidi tərkibində və SSRİ-də rayon bölgüsünə qədər olan inzibati-ərazi vahidi. *Qəza naçalniki, ofiserlər, bir neçə yüz də kazak orada durmuşdu.* M.S.Ordubadi. *Çaparxananı idarə edən Rəhim bəy tamam qəzada* "*Gödək Rəhim bəy*" *adı ilə məşhur idi.* Ə.Haqverdiyev. *1921-ci ildə Azərbaycan qəzaları içərisində ikinci olaraq Qubada qəzet nəşr edilməyə başlayır.* Ə.Sadıq. // Qəza mərkəzi mənasında. *Qəzadan gələn işçi nitqlər söyləyirdi, idarələri təftiş edirdi və şikayətlərə baxırdı.* B.Talıblı.

**QƏZADAN** *zərf* Gözlənilmədən, təsadüfi olaraq, təsadüfən, birdən. *Sərçəni bir qırğı edərkən şikar; Bir tələyə oldu qəzadan düçar.* A.Səhhət. *Qəzadan o gecə həmin mənhus gecə imiş ki, məzlum artist onun sabahı günü xüsusi öz faciəsində axırıncı rolunu oynayıb, fani dünya ilə əbədi vida edəcəkmiş.* S.M.Qənizadə.

**QƏZAL** *is.* [*ər.*] Ahu, buynuzu hələ çıxmamış ceyran balası (klassik şeirdə: gözəl, dilbər mənasında işlənmişdir). *Gördü ki, bir ovçu dam qurmuş; Daminə qəzallar üz vurmuş*. Füzuli. *Zülfləri sünbüldür, yanağı lalə; Baxışı tən edər vəhşi qəzalə*. S.Ə.Şirvani.

**QƏZALƏ** *is.* [*ər.*] *klas*. 1. Dişi ceyran; dişi ceyran balası. *Gərək gözlərinə millər çəkilə; Hər kim desə vəhşi qəzalə sənə*. Q.Zakir.

2. *məc.* Ceyran gözünə işarədir. *Zülfləri sünbüldür, yanağı lalə; Baxışı tən edər vəhşi qəzalə*. M.P.Vaqif.

**QƏZAVAT** *is.* [*ər.*] *din. köhn*. Müsəlmanlıqda: islam dinindən olmayan xalqlarla din uğrunda aparılan müharibə; cihad.

**QƏZAVƏT** *is.* [*ər.*] *din. köhn.* Qazilik, qazi idarəsi, dini idarə. *Mülki və siyasi işlər hökumətə aid məsələ olduğundan, qəzavət bu işə qarışmamışdır.* M.S.Ordubadi.

**QƏZAVƏTXANA** *is.* [*ər.* qəzavət və *fars.* ...xanə] Dini məhkəmə, qazıxana. *Ruhaniləri və qazıları ancaq məscidlərdə və qəzavətxanalarda görməlidir.* M.S.Ordubadi. *Qaldı bu barədə nəqdən xeyli məbləğ lazımdır ki, qəza qazisi qəzavətxanasında bu iş hiyleyişərə salınsın.* S.Rəhimov.

**QƏZA(VÜ) QƏDƏR** *is.* 1. Tale, qismət, müqəddərat. *Müvərrixlər* [Napoleona] *qəzavü qədərin oğlu ləqəb veribdirlər.* M.F.Axundzadə. *Qəzavü qədərin ağırlığını biz çəkməsək də, kim çəkəcəkdir?* M.S.Ordubadi. *Kazım da qəzavü qədərə inanan adam olduğu üçün, arvadın sözləri ona bir az təsəlli verdi.* Çəmənzəminli.

2. Başa gələn hadisə, əhvalat, macəra, qəziyyə. *Əgər keçən vaxtlarda mənim başıma gələn qəzavü qədəri nəql eləsəm, o vədə görərsiniz ki, dustaqxanadan qorxmağa mən çox haqlıyam.* C.Məmmədquluzadə. *Mənim qəzavü qədərim çoxdur, çox işdə olmuşam.* A.Şaiq. *Səməd dayının başına gələn qəzavü qədər qayət maraqlı olduğundan, hər iki kişinin sinirlərini oyatdı.* B.Talıblı.

**QƏZAZƏDƏ** *sif.* [*ər.* qəza və *fars.* ...zədə] Qəzaya uğramış, qəzadan zərər görmüş.

**QƏZÉT** *is.* [*ital.*] Hər gün, bəzən vaxtaşırı nəşr edilən və ictimai-siyasi həyatın cari məsələlərindən bəhs edən, habelə tənqidi və kütləvi elmi məqalələr dərc edən böyük səhifələr şəklində dövri mətbuat orqanı. *Gündəlik qəzet. Həftəlik qəzet. Qəzet müxbiri.* – [Səttarxan:] *Bizə öz ana dilimizdə məktəb, kitab, qəzet lazımdır.* M.S.Ordubadi. *Novruzun qəzetdə çıxmış şəkli əldən-ələ dolaşır, onun adı dillərdə əzbər olurdu.* S.Rəhman. ◻ **Qəzetə vurmaq** *dan.* – qəzetdə tənqid etmək, qəzetdə ifşa etmək. [Mədəd:] *Bu boyda kənddə bizdən savay adam tapmadınız qəzetə vurasınız?* İ.Əfəndiyev; // ümumiyyətlə, haqqında qəzetdə yazılmaq. **Divar qəzeti** – idarə, ya müəssisənin yerli ictimai təşkilatının əl ilə, yaxud maşında yazılıb divara vurulan qəzeti. *Zavodun divar qəzeti. Məktəbin divar qəzeti.* – *..Divar qəzeti üçün çəkdiyim şəkildə yazın əvvəlində Ağsu qovaqlarının başında hacıleyləklər yuva tikmişdi.* Ə.Məmmədxanlı.

◊ **Canlı qəzet** – hər cür yenilikləri bilən və yayan adam haqqında.

**QƏZETÇİ** *is.* 1. Qəzet nəşr edən, qəzet sahibi, yaxud mühərriri. *Mənə hər qəzetçi bərəldir gözün; Yazır hey qəzetlərdə məktəb sözün.* M.Ə.Sabir. *Qəzetçi bir elə şəxsdir, ağlı, kəmalı cəhətcə yaxşı əhvalatlar, yaxşı xəbərlər yığıb çap eləyib dağıdar o yan-bu yana.* C.Məmmədquluzadə.

2. Qəzet işçisi, qəzet müxbiri.

3. B a x **qəzetsatan**.

**QƏZETÇİLİK** *is.* Qəzet nəşr etməklə, ya qəzetə yazmaqla məşğul olma; qəzet redaktorluğu; qəzetçinin peşəsi, ixtisası; mühərrirlik.

**QƏZETXANA** *is. köhn.* Qəzet idarəsi, qəzet redaksiyası.

**QƏZETSATAN** *is.* Küçədə əlində, ya budkada qəzet satan adam. *Körpü üstündə cürbəcür səslər eşidilirsə də, qəzetsatanların səsi bütün bu səslərə üstün gəlirdi.* M.S.Ordubadi.

**QƏZƏB** *is.* [*ər.*] Hiddət, acıq, hirs, qeyz. [Səba xanım:] *Bir tərəfdən mələkəyə ürəyim yanır, o biri tərəfdən də Atabəyin qəzəbindən qorxuram.* M.S.Ordubadi. *Ağıllı qoca .. sözə qarışdı, xanın ürəyindəki qəzəb atəşinə su səpməyə çalışdı.* M.Rzaquluzadə. *Balaca Abbasqulunun insanpərvərliyi zalım xanın qəzəbinə üstün gəldi.* Ə.Sadıq. ◻ **Qəzəbi tutmaq** – çox hiddətlənmək, qəzəblənmək, qeyzlənmək. *Bir dəfə nə üstə isə naçalnikin buna qəzəbi tutub dedi: – Səfər! Papağını götür, buradan get.* Ə.Haqverdiyev.

**QƏZƏBLƏNDİRİLMƏ** "Qəzəbləndirilmək"dən *f.is.*

**QƏZƏBLƏNDİRİLMƏK** *məch.* Çox hirsləndirilmək, qəzəblənməsinə, hiddətlənməsinə səbəb olmaq, qeyzləndirilmək.

**QƏZƏBLƏNDİRMƏ** "Qəzəbləndirmək"-dən *f.is.*

**QƏZƏBLƏNDİRMƏK** *f.* Çox hirsləndirmək, hiddətləndirmək, qızışdırmaq; hirslənməsinə, qəzəblənməsinə, hiddətlənməsinə səbəb olmaq. *Lakin bu hal onu düşündürməkdənsə, daha da qəzəbləndirmişdi.* M.İbrahimov.

**QƏZƏBLƏNMƏ** "Qəzəblənmək"dən *f.is.*

**QƏZƏBLƏNMƏK** *f.* Çox hiddətlənmək, hirslənmək, qızmaq, açığı tutmaq, özündən çıxmaq, qızışmaq. // Eyni mənada heyvanlar haqqında. *Qəzəblənmiş köpəklər də arxada durub, mollanın sözünə həmahəng olaraq hürür, dəhşətli, əzəmətli sükutu pozurdular.* B.Talıblı. *Qurd cavab tapmadı, qəzəbləndi; Qışqırıb çox acıqlı səsləndi.* A.Səhhət.

**QƏZƏBLİ** *sif.* və *zərf* Hiddətli, qeyzli, hirsli, acıqlı. *Qəzəbli baxış. – Bəy qapıya çıxdı. Nəbi yaxın gedib, onun qolundan yapışdı, üzünə qəzəbli baxıb dedi..* "Qaçaq Nəbi".

**QƏZƏBNAK** *zərf* [*ər.* qəzəb və *fars.* ...nak] *köhn.* Qəzəbli, qəzəbli halda. *Əkbər cavab verməyib, axır qəzəbnak: "Bir yol, sənin borcun deyil", – deyib gedib yatdı.* Ə.Haqverdiyev. ◻ **Qəzəbnak olmaq** *köhn.* – qəzəblənmək, hiddətlənmək, bərk acığı tutmaq. [Şahmar bəy:] *Nə bais olub bu qədər qəzəbnak olmağınıza?* N.Vəzirov. *Gülpəri bu əhvalatdan qəzəbnak olub: – Təzə gəlini beləmi qəbul edərlər, sən məni buraya yasamı gətirmisən? – deyə qışqırdı.* S.S.Axundov.

**QƏZƏL** *is.* [*ər.*] 1. *ədəb.* Eşq və məhəbbəti tərənnüm edən, beytlərinin qafiyəsi bir olan 5-10 beytli lirik şeir (əski şeir forması). *Füzulinin qəzəlləri. – Gəl danışma müxəmməsdən, qəzəldən; Şeri-həqiqətdən, mədhi-gözəldən..* M.V.Vidadi. *O kimdir sularda qəzəl oxuyur? Cahana hər gələn bir əsər qoyur.* S.Vurğun.

2. *mus.* Mahnı – romans janrına yaxın, kiçik formalı musiqi əsəri. *Üzeyir Hacıbəyovun Nizaminin sözlərinə yazdığı "Sevgili canan", "Sənsiz" qəzəlləri.*

◊ **Qəzəl oxumaq** *məc.* – boşboğazlıq etmək, boş-boş danışmaq.

**QƏZƏLÇİ** *sif.* və *is.* Qəzəl, yaxud köhnə qəzəl şəklində şeir yazan. *Qəzəlçi şair.*

**QƏZƏLÇİLİK** *is.* Qəzəl, yaxud köhnə qəzəl şəklində şeir yazma meyli. *C.Cabbarlı öz məqalələrində .. Azərbaycan ədəbiyyatının qarşısında duran vəzifələri aydınlaşdırmağa çalışır, köhnə şeirdə əmələ gələn durğunluqdan – "nəzirəçilikdən", "qəzəlçilikdən" bəhs edirdi.* M.Arif.

**QƏZƏLXAN** *sif.* [*ər.* qəzəl və *fars.* ...xan] *köhn.* Qəzəl oxuyan, qəzəl söyləyən. // *məc.* Tərənnümçü. *Hər səhər, Heyran, qəzəlxan olmalı bülbül kimi; Gül firaqi-fəsli-güldə bülbülü zar öldürər.* Heyran xanım. *Gedənlər qaranlığın qoynuna girib gözdən itirkən, o, Gəncənin qəzəlxan bülbülü susdu.* M.S.Ordubadi.

**QƏZƏLİYYAT** *is.* [*ər.*] *köhn.* 1. Qəzəllər; qəzəllər məcmuəsi. *Füzulinin, Seyid Əzimin qəzəliyyatı. – Orta Asiya Şərqə qəzəliyyat və fəlsəfə cəhətcə bir çox böyük şəxslər vermişdir.* Ə.Haqverdiyev.

2. *məc.* Boş söhbətlər.

**QƏZƏLLƏMƏK** *f.* 1. Qəzəl söyləmək, qəzəl oxumaq.

2. *məc.* Uzunçuluq eləmək, boş-boş danışmaq.

**QƏZƏVAT** b a x **qəzavat**.

**QƏZİL** *is.* Keçi qılı. *Deyir, gərək bu saat iki keçinin qəzilini verəsən.* Ə.Vəliyev. // Keçi qılından toxunmuş (düzəldilmiş). *Qəzil xurcun. Qəzil sicim. –* [Kişi] *çubuğunu .. söykəyib, qəzil xurcundan qılçıqlı arpanı çuxasının ətəyinə doldurdu.* S.Rəhimov.

**QƏZİLLƏMƏ** "Qəzilləmək"dən *f.is.*

**QƏZİLLƏMƏK** *f. məh.* 1. Möhkəm bir iplə bağlamaq.

2. *məc.* Dilə tutmaq, tovlamaq, aldatmaq, dolaşdırmaq.

**QƏZİLLİ** *sif.* Qıllı. *Sürünün qabağında uzun qəzilli, dik, burma buynuzlu, ala erkəc başını yerə əyir.* S.Rəhimov.

**QƏZİYYƏ** *is.* [*ər.*] 1. Əhvalat, hadisə, vaqiə, təsadüf, macəra. [Vəzir:] *A kişi, bu gün başıma bir qəziyyə gəlibdir ki, heç fikrimdən keçməzdi.* M.F.Axundzadə. *Məmmədrza Tamamın faciəli qəziyyəsini nağıl etdikdə, .. göz yaşları neysan yağmuru kimi tökülüb otları islatdı.* S.S.Axundov. // İş, məsələ mənasında. *Bu, həlli çətin olan bir qəziyyədir.*

2. Məntiqdə: hökm, fikir, müddəa. *..Biz daima bir-birinə zidd olan iki qəziyyəni bir-birinə qarışdıraraq, bir qəziyyə saymışıq.* M.F.Axundzadə.

**QIC: qıc olmaq** – keyləşmək, hissizləşmək, çəng olmaq, hərəkətdən düşmək. *Əl-ayağı qıc olmaq. Qorxudan bədəni qıc oldu. – Çimən adamın qol və ya qıçı qıc olduqda onu dərhal sahilə çıxarıb, çəng olan qolunu və ya qıçını ovmaq lazımdır.* Babayev.

**QICAMA** “Qıcamaq”dan *f.is.*

**QICAMAQ: dişlərini qıcamaq** – acığından, hiddətindən və ya başqa bir səbəb üzündən dişlərini bir-birinin üstünə basıb bərk sıxmaq. *Pənah dişlərini qıcıyıb əlini qaldırdı.* İ.Məlikzadə. *Qədim dişlərini qıcayıb: – Mirab, – dedi, – buyurursunuz bu gün də su olmayacaq?!* S.Rəhimov. *Mənim də dədəmin baş-gözü şişib, – deyə Mahmud dişlərini qıcadı.* P.Makulu.

**QICANMA** “Qıcanmaq”dan *f.is.*

**QICANMAQ** *f.* Birini vurmaq və ya qorxutmaq məqsədi ilə əlini və ya başqa bir şeyi onun üzərinə qaldırmaq; qolaylanmaq. // Üzərinə atılmaq.

**QICIQ** *is.* 1. Xarici mühitin orqanizmə, yaxud onun bir hissəsinə təsiri nəticəsində əmələ gələn təxərrüş halı. *Bütün canlılar mühitin qıcıqlarına maddələr mübadiləsinin dəyişməsi ilə cavab verir, yəni reaksiya göstərir.* M.Axundov. *Orqanizmi gücü müxtəlif olan qıcıqların təsirinə alışdırmaq lazımdır.* Babayev.

2. B a x **qıdıq**.

**QICIQLAMA** “Qıcıqlamaq”dan *f.is.*

**QICIQLAMAQ** *f.* 1. B a x **qıdıqlamaq**. *..Toğluların yumşaq yunu və istiliyi sanki Qulunun əlini qıcıqlayırdı.* M.İbrahimov.

2. Əsəbiləşdirmək, təsir etmək. *İçərisində sanki bir şey üzülmüşdü, ətrafında gördüyü hər şey ona toxunur, qıcıqlayırdı.* Çəmənzəminli.

**QICIQLANDIRICI** b a x **qıcıqlayıcı**.

**QICIQLANDIRILMA** “Qıcıqlandırılmaq”-dan *f.is.*

**QICIQLANDIRILMAQ** *məch.* Təxərrüşə gətirilmək, gicişdirilmək, qıdıqlandırılmaq.

**QICIQLANDIRMA** “Qıcıqlandırmaq”dan *f.is.*

**QICIQLANDIRMAQ** *f.* Orqanizmə, yaxud onun bir hissəsinə təsir etmək, təxriş etmək, gicişdirmək. *Limonun turşusu dilin əsəblərini qıcıqlandıraraq, vəzini tüpürcək ifrazına vadar edir.* Hacıyev. *Kartof bişirilmiş suda bağırsaqları qıcıqlandıran maddə vardır, buna görə bu su heyvanlara verilməməlidir.* “Zootexniya”.

**QICIQLANMA** “Qıcıqlanmaq”dan *f.is.;* təxərrüş.

**QICIQLANMAQ** *f.* Qıcıq hiss etmək, qıdıqlanmaq, gicişmək. *Surxay burnunun qıcıqlandığını hiss etdi.* İ.Əfəndiyev.

**QICIQLAYICI** *sif.* Qıcıqlandıran, qıcıq təsiri oyadan, təxriş edən, təxərrüşə gətirən. *Bir qədər sonra* [Qoçər] *kəskin qıcıqlayıcı bir qoxudan ayılıb yenə gözlərini açdı.* M.Rzaquluzadə.

**QICILDANMAQ** *f. dan.* Maraqlanmaq, həvəs göstərmək, kişilik hissləri ayılmağa başlamaq. *Cəmilin bığ yeri çoxdan tərləmişdi. Necə deyərlər, yavaş-yavaş qıcıldanır, gəlinə, qıza baxırdı.* Ə.Vəliyev.

**QICIMAQ** 1. B a x **qıcamaq**.

2. B a x **qıcırdamaq**.

**QICIRDAMA** “Qıcırdamaq”dan *f.is.*

**QICIRDAMAQ** *f.* Bir-birinə sürtülərək qıcırtı səsi çıxarmaq. *Oxucum, yaxın gəl, bir diqqətlə bax; Qollarında zəncir qıcırdayaraq; O, qabaqda gedən kimdir, sorsana!* R.Rza. *Xanın bütün vücudu əsdi, dişləri qıcırdadı, gözləri dumanlandı.* M.Rzaquluzadə.

**QICIRDATMA** “Qıcırdatmaq”dan *f.is.*

**QICIRDATMAQ** *f.* İki şeyi (və ya dişlərini) bir-birinə sürtərək qıcırtı səsi çıxarmaq. *Dişlərini qıcırdatmaq.* – [Beyrək] *dişlərini bir-birinə sıxıb qıcırdatdı və başını qaldırıb göyə, .. ulduzlara baxdı.* M.Rzaquluzadə. *Turac dişlərini qıcırdadaraq Uğura* baxır. İ.Əfəndiyev.

**QICIRTI** *is.* İki şeyin (və ya dişlərin) bir-birinə sürtülməsindən hasil olan səs. *Dişlərinin qıcırtısından yatmaq olmur. – ..Arabaların qıcırtısı, şən uşaqların bağırtı və gurultusundan canlı və dəbdəbəli görünən kəndi, indi səs-səmirsizlikdən irəli gələn bir hüzn qaplamışdı.* A.Şaiq. *O, yerində qımıldandı və ayağına vurulmuş ağır paslı zəncirin qıcırtısı sanki onu ehtiyatlı olmağa çağırırdı.* M.Rzaquluzadə.

**QICIRTMAQ** b a x **qıcırdatmaq**. *Molla Kərim də dişlərini qıcırdıb, əsasının şiş ucu ilə çuvalın o yan-bu yanına bir-iki dəfə vurdu.* B.Talıblı.

**QICITMA** “Qıcıtmaq”dan *f.is.*

**QICITMAQ** *f.* 1. B a x **qıcamaq**. *Təməin indi nədir ya? Qıcadırsan dişini?* M.Ə.Sabir.

2. “Göz” sözü ilə bərabər: **göz qıcıtmaq** – göz ağartmaq, qorxutmaq, göz dikmək.

*Bilsin hamı nələr yazmış tarixlərə Azərbaycan; Dərs götürsün sözümüzdən yurdumuza göz qıcıdan!* R.Rza.

**QICQIRMA** "Qıcqırmaq"dan *f.is.* ☐ **Ürək qıcqırması** – mədə şirəsinin çoxluğu, bəzən də azlığı nəticəsində mədə nahiyəsində turşuluq hissi.

**QICQIRMAQ** *f.* İstidən, çox qalmaqdan və s. səbəblər üzündən turşuyub xarab olmaq, şişib qoxumaq. *Qatıq qıcqırıbdır.* // Qıcqırma halında olmaq, turşumaq, acımaq. *Xəmir qıcqırıbdır.*

**QICQIRMIŞ** *f.sif.* İstidən, çox qalmaqdan və ya başqa səbəbdən turşumuş, turşuyub xarab olmuş, şişib qoxumuş. *Qıcqırmış süd. Qıcqırmış xəmir. – Şərbət bir az qalanda qıcqırıb xarab olur və belə qıcqırmış şərbət arıları naxoş edir.* H.Zərdabi.

**QICQIRTMA** "Qıcqırtmaq"dan *f.is.*

**QICQIRTMAQ** *f.* Bir şeyin qıcqırmasına səbəb olmaq, turşutmaq. *Qatığı qıcqırtmaq. Südü qıcqırtmaq. Xəmiri qıcqırtmaq.*

**QICLAŞMA** "Qıclaşmaq"dan *f.is.*

**QICLAŞMAQ** *f.* Qıc olmaq.

**QICLIQ** *is.* Qıc olmuş bədən üzvünün halı; keylik, hissizlik, çənglik.

**QIÇ** *is.* 1. İnsan bədəninin, ombadan başlamış ayağa qədər olan və insanın yeriməsinə xidmət edən üzvü. *Qıçları ağrımaq. Qıçları əyri. Qıçı sınmaq. – Bəhram arxası üstə sərilib, qıçlarını tamam uzatdı.* Ə.Vəliyev. // Heyvanlarda eyni vəzifəni görən bədən üzvü. *Atın dal qıçları qara, qabaq qıçları isə ağdır. – Tısbağa başını qınına çəkən kimi topal qıçını altına çəkib gizlətdi.* Mir Cəlal.

2. Bir şeyin (mebelin və s.-nin) yerə dirənən hissəsi, duracağı. *Stolun bir qıçı sınmışdır. – İndi də tövlənin bir küncünə atdığı sınıq-sınıq kürsünün qıçına mıx çalırdı.* M.İbrahimov.

**QIÇA¹** *is.* Ağac və ya gül budağı; bitkinin qolu. *Qarğıdalı toxumu dən qıçadan ayrıldıqdan sonra diqqətlə təmizlənməli, onun cücərmə qabiliyyəti yoxlanılmalıdır.* (Qəzetlərdən). *Bəzən dənləri və özəyi ilə birlikdə bütün qıçanı üyüdüb un hazırlayırlar.* "Zootexniya". *Sən vətən bağında güllü bir qıça; İyləyib nədəndir, doymuram səndən?* S.Rüstəm.

**QIÇA²** *is.* Bir şeyin bölündüyü, ayrıldığı hissələrdən hər biri; tikə, parça, dilim. *Bir qıça paxlava. Alma qıçası. Bir qıça soğan. – Gördüm ətəklərini dizinin altına soxdu, çayına da bir qıça qənd atdı.* Qantəmir.

**QIÇALAMA** "Qıçalamaq"dan *f.is.*

**QIÇALAMAQ** *f.* Qıça-qıça doğramaq.

**QIÇALANMA** "Qıçalanmaq"dan *f.is.*

**QIÇALANMAQ** *məch.* Qıça-qıça doğranmaq.

**QIÇAVARİ** *sif.* Qıça kimi, qıçaya bənzər, qıça şəklində.

**QIÇSIZ** *sif.* Bir qıçı, yaxud qıçları olmayan; qıçı, yaxud qıçları kəsilmiş. *Qıçsız adam. Qıçsız stol.*

**QIÇSIZLIQ** *is.* Qıçı, yaxud qıçları olmayan adamın halı.

**QIDIQ** *is.* Bədənin bir yerinə əl və s. ilə toxunduqda onda əmələ gələn və adamın qeyri-ixtiyari gülməsinə səbəb olan hal; yüngül təxərrüş, qıcıq; qıcıqlanma hissi. ☐ **Qıdığı gəlmək (tutmaq)** – b a x **qıdıqlanmaq** 2-ci mənada. *Ayağının altına əl vurduqda, qıdığı tutur. – Atası onun boğazının altından öpər, onun qıdığı tutub gülməkdən uğunardı.* M.Rzaquluzadə. **Qıdığını tutdurmaq** – b a x **qıdıqlamaq**.

**QIDIQLAMA** "Qıdıqlamaq"dan *f.is.*

**QIDIQLAMAQ** *f.* 1. Birinin bədəninin bir yerinə əl və s. ilə toxunmaqla həmin yerin qıcıqlanmasına səbəb olmaq. *Uşağı qıdıqlamaq ziyandır. – Qumru öz arıq və uzun boynunu uzadaraq Məsuməni qucaqlayıb öpməyə və qıdıqlamağa başladı.* S.Şamilov.

2. *məc.* Təxərrüşə gətirmək, qıcıqlandırmaq. *Kababın iyi burnumuzu qıdıqladı.*

**QIDIQLANMA** "Qıdıqlanmaq"dan *f.is.*

**QIDIQLANMAQ** 1. "Qıdıqlamaq"dan *məch.*

2. *qayıd.* Bir yerinə toxunulduqda qıdığı gəlib qeyri-ixtiyari gülmək.

**QIDIQLAŞMA** "Qıdıqlaşmaq"dan *f.is.*

**QIDIQLAŞMAQ** *qarş.* Bir-birini qıdıqlamaq.

**QIDIQLI** *sif.* Qıdığı gələn, qıdığı tutan, tez qıdıqlanan, qıdığa çox həssas olan. *Qıdıqlı adam.*

**QIDIR-BIDIR** *is. dan.* Tez-tez və anlaşılmaz danışma.

**QID-QID** *is. dan.* Deyinmə; dedi-qodu, mübahisə.

**QIF** *is.* Mayeləri qaba tökmək və ya süzmək üçün alt tərəfində dar lüləsi olan konusşəkilli cihaz.

**QIFGÜLÜ** *is. məh. bot.* Çoxillik sürünən ot bitki və onun qıfa oxşayan çiçəyi.

**QIFIL** *is.* Qıfıllamaq (bağlamaq) üçün açarla bağlanıb açılan alət; kilid. *Qapının qıfılını açmaq. – Məktəbin qapısında böyük bir qıfıl asılmışdı.* A.Şaiq. // *xüs.* Müxtəlif mexanizmlərdə və s.-də həmin vəzifəni görən qurğu. [Heydər] *aşağıdan qalxıb, bərabərinə yetişən qıfılı qazıma borusuna keçirtdi.* M.Hüseyn.

**QIFILBƏND** 1. *sif.* Möhkəm bağlanmış, qıfıl ilə bağlanmış.

2. *ədəb.* Aşıq ədəbiyyatında: müəmmalı sual (tapmaca) şəklində şeir forması.

**QIFILÇI** *is.* Qıfıl qayıran usta.

**QIFILLAMA** "Qıfıllamaq"dan *f.is.*

**QIFILLAMAQ** 1. *t.-li.* Qıfıl ilə bağlamaq. *Qapını qıfıllamaq. Dükanı qıfılladılar. – Musa kişi Əli əmniyyəbaşı yatan otağı çöl tərəfdən qıfıllayıb, uşaqlarının yanına qayıtdı.* M.İbrahimov.

2. *t.-siz. məc.* Ağzını yummaq. // Əmr formasında: **qıfılla** – ağzını yum! sus! dinmə!

**QIFILLANMA** "Qıfıllanmaq"dan *f.is.*

**QIFILLANMAQ** *məc.* Qıfıl ilə bağlanmaq.

**QIFILLANMIŞ** *f.sif.* Qıfılla bağlanmış. [Kitabçada] *göstərilir ki, elmin qıfıllanmış qapıları əməkçi xalqın üzünə açılır.* S.Rəhimov. // Bağlanmış.

**QIFILLATMA** "Qıfıllatmaq"dan *f.is.*

**QIFILLATMAQ** *icb.* 1. Qıfılla bağlatmaq.

2. *məc.* Ağzını yumdurmaq, danışmağa qoymamaq.

**QIFILLI** *sif.* Qıfılla bağlanmış, bağlı. *Qıfıllı qapı. Qıfıllı sandıq. Darvaza küçə tərəfdən qıfıllıdır.* // Qıfılı olan.

**QIFVARİ** *sif.* Qıf şəklində olan, qıfaoxşar.

**QIĞ** *is.* Qoyun, keçi, dəvə və başqa heyvanların xırda yumrular şəklində olan ifrazatı (nəcisi). *Balam, nə işimiz var? Deyərik: dəvə gördün, qığın da görmədim.* M.F.Axundzadə.

**QIĞILCIM** *is.* 1. Yanar, yaxud qızarmış bir şeydən sıçrayan od zərrələri; çırtdaq, cılğam, çınqı. *O ki qaldı "qığılcım" kəlməsinə, azərbaycanca qığılcım ən kiçik od şərarələrinə deyilir.* M.F.Axundzadə. *Yoğun elektrik kabelinin mis qabığında, çeçələ barmağının ucu enində bir yer sürtülüb açılmış və iki xətt bir-birinə toxunub qığılcım vermiş, bundan da havaya hopan qaz od tutmuşdu.* M.Hüseyn. // Parlaq, işıldayan zərrə; parıltı, bərq. *Almazın qığılcımları. Brilyant qığılcım saçır.*

2. *məc.* Bir şeyin çox qüvvətli təzahürü, əlaməti, nişanəsi, işartısı mənasında. [Kərim babanın] .. *qalın iri dodaqlarında daşqın sevinc qığılcımları uçuşaraq: – Qızılquş, balasını bu səslə çağırır, – dedi.* A.Şaiq. *Bu şeirlər Sabir satirasının zəif bir qığılcımını andırsa da, orijinal xüsusiyyətə malik idi.* M.İbrahimov. *Lakin bu ümid qığılcımı bir an parlayıb yenə də söndü.* M.Rzaquluzadə.

**QIĞILCIMLANMA** "Qığılcımlanmaq"-dan *f.is.*

**QIĞILCIMLANMAQ** *f.* Qığılcım çıxarmaq, qığılcım saçmaq; qığılcım kimi işıq vermək, qığılcım kimi parlamaq; bərq vurmaq.

**QIĞILCIMLI** *sif.* Qığılcım verən, qığılcım çıxaran, qığılcımsaçan. // *məc.* Odsaçan, coşqun, ehtiraslı, qızğın.

**QIĞILCIMSAÇAN** b a x **qığılcımlı**. [Toğrul] *qığılcımsaçan böyük gözlərini bir an yerə dikərək,* [növbətçinin] *gözləri içinə dərin-dərin baxdı.* H.Nəzərli.

**QIĞILDAMA** "Qığıldamaq"dan *f.is.*

**QIĞILDAMAQ** *f.* Qığ-qığ etmək (körpə uşağın gülərək çıxardığı səs). *Əşrəf hər səhər quşlar kimi erkən oyanar, kiçik beşiyinin içində qığıldamağa başlar.* A.Şaiq. // Qağıldamaq.

**QIĞILDANMA** "Qığıldanmaq"dan *f.is.*

**QIĞILDANMAQ** b a x **qığıldamaq**. [Xudaverən] *yasavulun ayaq tərəfindən oynaqlayıb, – "Dədə, dədə!" – deyə qığıldandı.* S.Rəhimov.

**QIĞILDAŞMA** "Qığıldaşmaq"dan *f.is.*

**QIĞILDAŞMAQ** *qarş.* Bir yerdə, hamı birdən qığ-qığ səs çıxarmaq (körpə uşaqlar haqqında). // *Yerbəyerdən qığıldamaq. Qarğa kimi çox da qığıldaşmayın; Ay cücülər, bəsdi, cırıldaşmayın!* Ə.Nəzmi.

**QIĞILTI** *is.* Körpə uşağın çıxardığı səs, qığ-qığ səs çıxarması.

**QIĞIRDAQ** *is. anat.* Orqanizmin azca sərt, elastik birləşdirici toxumadan ibarət olan hissəsi və ya sümüklərin oynaqlarının üstünü örtən gəmircək, xımırtdək.

**QIĞIRDAQLI** *sif.* Qığırdağı olan, yaxud qığırdaqdan ibarət olan. *Qığırdaqlı sümük. Qığırdaqlı balıqlar.*

**QIĞ-QIĞ** *təql.* Körpə uşaqların gülərkən çıxardıqları səs.

**QIĞLAMA** "Qığlamaq"dan *f.is.*

**QIĞLAMAQ** *f.* Qığ buraxmaq, qığ ifraz etmək (qoyun, keçi, dəvə haqqında).

**QIĞLIQ** *is.* Qoyunun, keçinin gödək bağırsağı.

**QIXMIQ** *is. məh.* Ağacı, odunu yararkən qopub düşən parçalar, baltanın altından çıxan odun qırıqları, talaşa.

**QIXMIQLAMAQ** *f. məh.* Odunu balta ilə xırda-xırda doğramaq, qıxmıq halına gətirmək.

**QIJHAQIJ** *zərf* Çox sürətlə, çox iti, qıjıltı ilə. *Araz qıjhaqıj axır, dumanlı gecədir, gah-gah ildırım çaxır.* M.F.Axundzadə. *Adətimiz daş idi dəva günü; Tullar idik əldə sapan, qıjhaqıj.* M.Ə.Sabir. *Sellər qıjhaqıjla tüğyan edirdi.* İ.Əfəndiyev.

**QIJI** *is. bot.* Rütubətli yerlərdə bitən uzun və dilik-dilik yarpaqları olan bir bitki. *Əbil pendirlə qıjını lavaşın arasına qoyub, dürməklədi və çox iştaha ilə yedi.* Ə.Vəliyev.

**QIJILAMA** "Qıjılamaq"dan *f.is.*

**QIJILAMAQ** *f.* Qablaşdırılan meyvənin altına və üstünə qıjı qoymaq, qıjı ilə örtmək. *Alma yeşiklərini qıjılamaq.*

**QIJILATMAQ** *icb.* Qıjı qoydurmaq, qıjı ilə örtdürmək.

**QIJILDAMA** "Qıjıldamaq"dan *f.is.*

**QIJILDAMAQ** *f.* Qıjıltı səsi çıxarmaq, qıj-qıj etmək. *Çay yaman qıjıldayır. Tapançanın gülləsi qıjıldayıb keçdi. – Ox qıjıldadı və .. Buğacın iki kürəyinin arasına sancıldı.* M.Rzaquluzadə.

**QIJILIQ** *is.* Qıjı otu bitən yer. *Arxın qırağı başdan-başa qıjılıqdır. Öküz qıjılıqda yatıbdır.*

**QIJILTI** *is.* Çox iti axan suyun, yaxud havanı yarıb keçən cismin çıxardığı səs. *Qalın meşə, yaşıl ot adam boyunda, gözəl quşların nəğmələri, iti bulaqların qıjıltısı, havanın təmizliyi insana ləzzət verir.* N.Nərimanov. *Buğac .. oxu xanın qarşısında o qədər yaxından atdı ki, kamanın vıyıltısı ilə oxun qıjıltısı aydın eşidildi.* M.Rzaquluzadə.

**QIJILTILI** *sif.* Qıjıltı ilə axan, çox iti axan. *Qəhrəman .. aşağılarda, çox dərinlərdə axan qıjıltılı çaya baxırdı.* S.Rəhimov.

**QIJ, QIJ-QIJ** *təql.* Qıjıltı səsi. *Gəştə çıxsa ərşə qara qarğalar; Çalar qanadların, ay eylər qıj-qıj.* Aşıq Ələsgər.

**QIJOV** *is.* Çayda suyun çox sürətlə axdığı yer. *..Tor isə birdən ona güc gəlir, o da qabaqkı kimi özünü çayın qıjovuna verirdi.* S.Rəhimov.

**QIQQILDAMA** "Qıqqıldamaq" *f.is.*

**QIQQILDAMAQ** *f.* Gülmək. *..Bəylər də qıqqıldaya-qıqqıldaya* (z.) *qızların oynamasına çəpik çalırdılar.* C.Məmmədquluzadə.

**QIL** *is.* Bəzi heyvanların və insanın bədənində çıxan sərt, qalın tük. *Keçi qılı. At qılı. – Qaratoyuq tutmaq üçün at qılından cələ hörüb bağda, ağaclar altında çox xəzəl olan yerdə qururduq*. S.S.Axundov. *Möhkəm sarılmış keçi qılı sicim* [xanın] *biləklərini zəncir kimi kəsdi*. M.Rzaquluzadə.

◊ **Qıl kimi** – çox nazik, çox incə. *Qüssəsindən başımın qıl kimi incəlmiş tənim.* Füzuli. *Elə ki həşərat yavuq gəldi, buqələmun nazik qıl kimi dilini çıxarıb həşərat tərəfə uzadır.* H.Zərdabi. **Qıl qədər** – azacıq, lap az, zərrə qədər. **Qıldan asılmaq** – əmanətə bənd olmaq, bir təsadüfdən asılı olmaq, təhlükə altında olmaq. [Sona xanım:] *Gecələr sübhədək quru öskürək məni boğur; ürəyim qıldan asılır, indi qırılar, bir saatdan qırılar, – deyirəm.* Ə.Haqverdiyev. **Qılı qıldan seçmək** – incədən incəni seçmək, ən xırda şeyi seçmək, görmək. **Aralarından qıl keçməmək** – çox yaxın, mehriban dostlar haqqında. *..Cavanlıqdan ta Kərbəlayı Heydər ölən günə kimi Xudayar bəy ilə onun arasından qıl keçməzdi.* C.Məmmədquluzadə.

**QILAN** *is. məh.* Əyrilə bilməyən yoğun tüklü yun.

**QILBAŞ** *is.* Çox zaman əl barmaqlarının baş tərəfinə dırnaq dibinə çıxan əziyyətli yara; dolama.

**QILBOYUN** *sif.* Boynu nazik, çox arıq.

**QILCA** *zərf* Zərrə qədər, zərrəcə, bir tük qədər, qətiyyən, əsla.

**QILÇA** b a x **qıç**. *Qılçası ağrımaq. Qılçası sınmaq. – Ancaq biçarə arvadın sağ qılçası dizdən yuxarı xınc-xınc olmuşdu.* C.Məmmədquluzadə. [Nadir Məcidə:] *Get, sən də şəhərdə fəhləlik elə. – Bu qıçlarımla hara gedim? – deyə Məcid çolaq qılçalarını göstərdi.* B.Talıblı. *Ceyran kimi zərif Qarabağ atı birdən qılçaları biçilmiş kimi yerə sərildi*. M.Rzaquluzadə.

**QILÇALAMA** "Qılçalamaq"dan *f.is.*

**QILÇALAMAQ** *f.* Qılçasından tutmaq, yapışmaq. *Qılçalayıb yerə vurmaq. Keçini qılçalayıb tutmaq.*

**QILÇALANMAQ** *məch.* Qılçasından tutulmaq.

**QILÇIQ** *is.* 1. Sünbüldə dənin qişası ucundakı uzun, qıl kimi nazik, iti, diş-diş tikan. *Arpa qılçığı. Buğda qılçığı. – Tapdıq .. aran dəni sünbüllərinin uzun qılçıqlarını tumarlayıb iri ovcunun arasına aldı*. Ə.Əbülhəsən.

2. Balıqların əti içərisindəki incə və ucu iti sümüklər; tıx. *Bəzi balıqların qılçığı olmur.*

**QILÇIQLAMA** "Qılçıqlamaq"dan *f.is.*

**QILÇIQLAMAQ** *f.* Balığın qılçığını çıxarmaq, təmizləmək.

**QILÇIQLANMA** "Qılçıqlanmaq"dan *f.is.*

**QILÇIQLANMAQ** 1. *məch.* Qılçığı təmizlənmək (balığın).

2. *t-siz.* Qılçıq əmələ gətirmək, baş açmaq (taxıl).

**QILÇIQLI** *sif.* Qılçığı olan, tıxı olan, tıxlı. *Qılçıqlı arpa. Qılçıqlı balıq. – Çubuğunu cütün macına söykəyib, qəzil xurcundan qılçıqlı arpanı çuxasının ətəyinə doldurdu*. S.Rəhimov.

**QILÇIQSIZ** *sif.* Qılçığı olmayan. *Qılçıqsız balıq. Qılçıqsız buğda*.

**QILDIQ** *is. məh*. İnam, etiqad, inanma.

**QILDIQSIZ** *sif. məh*. İnamsız, etiqadsız, inanmayan, etibarsız.

**QILDIRMA** "Qıldırmaq"dan *f.is.*

**QILDIRMAQ** *icb. köhn.* Qılmağa, etməyə məcbur etmək.

**QILIC** b a x **qılınc**.

**QILIQ** *is.* Xasiyyət, yaxşı rəftar. [Tubu:] *Arvadın gərək qılığı olsun*. Ə.Haqverdiyev.

◊ **Qılığına girmək** – birinin etibarını qazanmaq, yaxud müəyyən bir məqsəd üçün ona xoş sifət göstərməklə, şirin dil ilə, yaxud yaltaqlanmaqla ürəyini ələ almaq, tovlamaq. *Mənim qardaşımın da qılığına belə girmişdi ki, bir sözü iki olmurdu.* Ə.Haqverdiyev. *Pərzada elə gəldi ki, kimsə qızın qılığına girib başdan çıxarıb, yoxsa belə şey olmaz.* Mir Cəlal. [Mirzə Qərənfil:] *Dava yox, biz onun qılığına girib otaqların ikisini ələ keçirə bilərik.* S.Rəhman. **Qılıq eləmək (etmək)** – yaltaqlıq etmək. [İmran:] *Hə, indi bildim ki, mənə etdiyin bu qılıqlar nə üçün imiş.* S.S.Axundov. *Ömər xan kimi bir dilavər on*a [Fətəli xana] *qılıq eləyir, amma axmaq Məmmədhəsən dirsək göstərir..* Çəmənzəminli.

**QILIQLAMAQ** *f. dan.* Birinin qılığına girmək, tovlamaq, aldatmaq, yoldan çıxarmaq.

**QILIQLANMAQ** *f.* Qılığına girməyə çalışmaq, yaltaqlanmaq.

**QILIQLI** *sif.* Yaxşı xasiyyətli, hamı ilə yola gedən, xoşrəftar. *Qılıqlı adam.*

**...qılıqlı** – bir sıra sözlərə qoşularaq, həmin sözlərin ifadə etdiyi mənada xasiyyət bildirən mürəkkəb sifət düzəldilir; məs.: arvadqılıqlı (arvadxasiyyətli), ilanqılıqlı (ilanxasiyyətli).

**QILIQLILIQ** *is.* Yaxşı xasiyyətlilik, xoşrəftarlıq.

**QILIQSIZ** *sif.* Rəftarı olmayan, xasiyyəti kəc, bədrəftar, heç kəslə yola getməyən. *Fəqət bu quru, qılıqsız adamla yan-yana çalışmaq məni sıxırdı*. A.Şaiq.

**QILIQSIZLIQ** *is.* Rəftarsızlıq, heç kəslə yola getməmə, pis xasiyyət.

**QILINC** *is.* 1. Xəncərdən böyük, əyri və ya düz, bir ağızlı kəsər silah. *İti qılınc. – Qılınc yarası gedər, dil yarası getməz.* (Ata. sözü). *Onun başının üstündən divarda .. qotazlı bir qılınc, qalxan, yay və sadaq asılmışdı.* M.Rzaquluzadə. ☐ **Qılınc kimi** – çox itilik, kəskinlik mənasında. *Yenə mədənlərdə böyük tətildir; Soyuq qılınc kimi insanı kəsir.* S.Vurğun.

2. Kotanın ağzı, torpağı kəsən hissəsi. *Kotanların iti qılıncları altından torpaq köprəyib qara bir hava kimi ətrafa daşırdı.* Ə.Məmmədxanlı.

3. Qabanların ağzı yanlarında qoşa olaraq əyri qılınc şəklində çıxan, müdafiə və hücum aləti vəzifəsini görən böyük diş. *Qaban qılıncı.*

◊ **Qılınc çalmaq** – bax **qılınc vurmaq**. [Əsgər bəy:] *Naçalnik, biz də düşmən qabağında qılınc çalmağa hazırıq!* M.F.Axundzadə. *Çaldı qılınc şahın atın peylədi.* S.Ə.Şirvani. *Qılınc çal, qoy gəlsin qoluna qüvvət.* Z.Xəlil. **Qılınc vurmaq** – qılıncla vuruşmaq. [Hüsaməddin:] *Mən Fəxrəddinlə bir cərgədə Azərbaycanın azadlığı uğrunda az qılınc vurmamışam.* M.S.Ordubadi. **Qılınc-qalxana çıxmaq** – davaya getmək, vuruşmaq. **Qılınc-qılınca gəlmək** – qılınclarını çəkib üz-üzə gəlmək, qılıncla vuruşmaq. **Qılınca sarılmaq** – davaya hazırlanmaq. **Qılıncdan keçirmək** – hamısını qılıncla öldürmək. *Lakin daşqəlbli qaniçən kazaklar buna baxmayaraq, zavallı işçiləri bacardıqca qılıncdan keçirirdilər.* S.S.Axundov. *Taygöz Yusif şəhərin .. əhalisini qılıncdan keçirtdi.* İ.Əfəndiyev. **Qılıncının dalı da kəsir, qabağı da** – sözü kəsərli, sözükeçən, böyük ixtiyar və nüfuz sahibi olan adam haqqında. [Tərlan:] *Sən ki həmişə qılıncımın dalı da, qabağı da kəsir, – deyib öyünürdün.* M.Hüseyn.

**QILINCBALIĞI** *is. zool.* Burnu qılınc kimi uzun və kəskin olan iri balıq cinsi.

**QILINCI** *sif. köhn.* Qılınc şəklində olan, dəridən tikilmiş uzun, şiş (papaq). *Uzunboylu, uzundonlu, qılıncı papaqlı, seyrək saqqallı Fazilin ağzı köpüklənmişdi.* S.Rəhimov.

**QILINCLAMA** “Qılınclamaq”dan *f.is.*

**QILINCLAMAQ** *f.* Qılıncla vurmaq, qılıncla çapmaq (kəsmək).

◊ **Kölgəsini qılınclamaq** – bax **kölgə**.

**QILINCLANMA** “Qılınclanmaq”dan *f.is.*

**QILINCLANMAQ** *məch.* 1. Qılıncla vurulmaq, qılıncla çapılmaq (doğranmaq, kəsilmək).

2. Belinə qılınc bağlamaq.

**QILINCLI** *sif.* 1. Qılıncla silahlanmış, belində, ya əlində qılınc olan. *Əlləri xəncərli və qılınclı qumuqlar iki tirə olub bir-birinə soxulmaq istəyirdilər.* Çəmənzəminli.

2. Qılıncı (3-cü mənada) olan. *Qılınclı qaban çox qorxuludur.*

**QILINCOTU** *is. bot.* Xalq təbabətində işlədilən bir bitki.

**QILINCVARİ** *sif.* Görünüşcə, formaca qılınca oxşayan. *Qılıncvari yarpaq.*

**QILINCYARPAQ** *sif. bot.* Yarpağı enli və uzun qılınc şəklində olan.

**QILINMAQ** *məch. köhn.* Görülmək, əmələ gətirilmək, edilmək, yerinə yetirilmək.

**QILQUYRUQ** *is. zool.* Quyruğunda iki uzun lələk olan çöl ördəyi.

**QILLANMA** “Qıllanmaq”dan *f.is.*

**QILLANMAQ** *f.* Tüklənmək, qıl gətirmək, qıl çıxarmaq, tük basmaq. *Boynunun ardı qıllanmışdır.*

**QILLI** *sif.* 1. Üzərində qıllar olan, sərt tüklü, tük gətirmiş, bədənini çox tük basmış. *Qıllı qaban. – Hətta Dəmir adlı qıllı boz köpək də .. gözlərini tütəkdən ayırmaz və ara-sıra həzin bir səslə zingildərdi.* A.Şaiq. *Əsgər qarıdan aralandı və dərəyə endi. Qapıda yatan boz qıllı itlər yerindən dik atılıb Əsgərə cumdular.* S.Rəhimov. // Kobud qoyun dərisindən tikilmiş. *Sazaqlı bir sabah idi, yel adamı kəsirdi. Qamış və kolluqlar arxasından qıllı papaqlar görünməyə başladı.* Çəmənzəminli.

2. *məc. köhn.* Qanmaz, kobud, qanacaqsız mənasında.

**QILLICA** *is.* 1. Vəhşi.

2. *bot.* Taxıl fəsiləsinə aid birillik bitki.

**QILLILIQ** *is.* Qıllı olma, tüklülük.

**QILMA** “Qılmaq”dan *f.is.*

**QILMAQ** *f. köhn.* Etmək, görmək, yerinə yetirmək, əda etmək, icra etmək. *Çün gəldi özünə, qıldı nalə; Yağdırdı xəzanı üzrə jalə.* Füzuli. *Söyləyim sözlərim eylə dil əzbər; Şirin nəsihətim qıl sinədəftər.* “Koroğlu”. *Vaqifin dərdini biləydi yarı; Dərdinə bir dərman qılaydı, barı.* M.P.Vaqif. *A sevgilim, aç bir niqab üzündən; Məcnun tək Leylaları divanə qıl.* A.Səhhət. *Sayrışan ulduzlar verib baş-başa; Gözəl camalına qılır tamaşa.* S.Vurğun.

**QILOV** *is. dan.* Kəsər alətləri itilətdikdə onların ağzında əmələ gələn tük kimi qırıntılar. *Ülgücü qayışa çək, qılovu getsin.*

**QILOVLAMAQ** *f. dan.* İtilənmiş bıçağı və s.-ni qayışa çəkərək qılovunu yox eləmək; itiləmək.

**QILOVLU** *sif.* Ağzında qılov qalmış (itilənmiş kəsər alətlər haqqında).

**QIM** *is. bot.* Taxıl fəsiləsindən çoxillik yem bitkisi.

**QIMILDA(N)MA** “Qımılda(n)maq”dan *f.is.*

**QIMILDA(N)MAQ** *f.* Yerində hərəkət etmək, yavaşca tərpənmək. *Mirzə Əliməmmədin o sakit qüruru sönmüşdü, rəngi qaçmış, qımıldanmağa belə halı yox idi.* Çəmənzəminli. *Uruz bu sözləri əsla eşitmirmiş kimi üzündə bircə əzələ də qımıldanmadı.* M.Rzaquluzadə. [Soldatlar] *..bir müddət yerlərindən qımıldana bilmirlər.* Ə.Məmmədxanlı.

**QIMILDAŞMA** "Qımıldaşmaq"dan *f.is.*

**QIMILDAŞMAQ** *f.* Hərə öz yerində qımıldanmaq, tərpənmək, hərəkət etmək; tərpəşmək. // Məc. mənada. *Günü-gündən millətlər qımıldaşırdı və özləri üçün hökumətdən növ-növ azadlıq tələb edirdi.* C.Məmmədquluzadə.

**QIMILDATMA** "Qımıldatmaq"dan *f.is.*

**QIMILDATMAQ** *f.* Yavaşca tərpətmək, oynatmaq. [Dursun] *qırxıq, yuvarlaq başını qımıldadaraq: – Vay, işim nə olacaq? – dedi.* A.Şaiq. [Əsgər] *əllərini qardaşının boynu altından salıb onu yerindən qımıldatdı.* Ə.Əbülhəsən.

**QIMILTI** *is.* Qımıldama, xəfif hərəkət, tərpəniş. *Lakin dodaqlarında sezilən xəfif bir qımıltı onun gülmək istədiyini .. aşkara çıxarırdı.* M.S.Ordubadi.

**QIMIŞIQ** *is. dan.* Təbəssüm, təbəssüm əlaməti. *Lakin onun gözündə sevinc dolu bir işıq; Rəngsiz dodaqlarında mehriban bir qımışıq.* R.Rza.

**QIMIŞMA** "Qımışmaq"dan *f.is.*

**QIMIŞMAQ** *f.* Dodaqaltı gülmək, gülümsəmək. *Usta bu sualın mənasını bilməsə də, Yunisi gülmək tutdu. Qımışıb, özünü saxladı.* Mir Cəlal. *Mirzə Kələntər maarif şöbəsinin müdirinin üzünə baxıb qımışdı.* S.Rəhman.

**QIMIZ** *is.* 1. Turşumuş at (bəzən dəvə) südündən hazırlanan qidalı içki. *Qımızla müalicə. – Buyur, zəhmət çək, atından düş yerə; Varımızdır qımız, çörək, bal, kərə.* A.Səhhət. *Məlumdur ki, at südündən müalicəvi əhəmiyyəti və yüksək qidalılığı olan qımız hazırlanır.* Səttarzadə.

2. Çox turş şey haqqında.

**QIMZANDIRMAQ** *f. məh.* Tərpətmək, dikəltmək, durğuzmaq, qalxızmaq.

**QIMZANMAQ** *f. məh.* Tərpənmək, qalxmaq istəmək, durmağa çalışmaq.

**QIMZATMAQ** *f. məh.* Tərpətmək, qalxızmaq, durğuzmaq.

**QIN** *is.* 1. Xəncər, qılınc və s. kəsər silahları qoymaq üçün qab. *..Şeypur səsləri ucaldı, atlılar bir kərə qılınclarını qınından çıxardılar.* M.S.Ordubadi. *Düşmən başı sağ olunca misri qılınc qına girməz.* R.Rza. *Almurad baba .. dəri qından bir qəmə çıxarıb satıla çəkdi.* İ.Əfəndiyev.

2. Bir şeyin daxili hissəsini örtən, onu əhatə edən, içində gizlədən bərk qabıq, örtü, pərdə və s. // Bağanın çanağı. *Bağa qınından çıxdı, qınını bəyənmədi.* (Ata. sözü).

◊ **Qınına çəkilmək, qınına girmək** – gizlənmək, özünü göstərməmək, öz dairəsindən kənara çıxmamaq, heç bir işə qarışmamaq. *Özlərini adətən xan məclisində sərbəst aparan təlxəklər də qorxularından qınlarına girdilər.* Çəmənzəminli. *İlan kimi sürünməkdən nə çıxar? Qına girib bürünməkdən nə çıxar?* Aşıq Bəylər. **Qanından çıxmaq** – həddini aşmaq, cızığından çıxmaq. **Başını qınına çəkmək** – b a x **baş**.

**QINAQ** *is.* Qınama, danlama, məzəmmət, töhmət, danlaq. *Qorxmamışıq dost görünən düşmənlərin qınağından.* R.Rza. *Ata ticarətə uyub qazanc gətirir, tacirlər mühiti isə getdikcə qınağı, məzəmməti artırırdı.* Ə.Əbülhəsən. [Sevər:] *Yazıq balam, .. bu ölümcül yaradan qurtarsa da, el qınağından qurtarmayacaq.* P.Makulu.

**QINAMA** "Qınamaq"dan *f.is.*

**QINAMAQ** *f.* Məzəmmət etmək, danlamaq, təqsirləndirmək, töhmətləndirmək. *Ey məni qınayan, ağlama, deyib; Ağlar yarı gedən bəs ağlamazmı?* M.V.Vidadi. *Qınamasın məni könlü bütünlər; Fikrim dağınıqdır, xatirim övraq.* Q.Zakir. *Dostlar uzun danışsam, məni qınamayın siz; Mən hələ az demişəm vətənimdən, elimdən.* S.Rüstəm.

**QINANMA** "Qınanmaq"dan *f.is.*

**QINANMAQ** *məch.* Məzəmmət edilmək, danlanmaq; təqsirləndirilmək, töhmətləndirilmək.

**QINC** *is.* [*ər.* ğunc] Naz, qəmzə, işvə, özünü əzib-büzmə. *Başı kəllədən daraqlı, ətəyi yerlə sürünən xanım qıncla* (z.) "*buyurun*" *deyib ağzını büzdü.* S.Rəhimov.

**QINCANMA** "Qıncanmaq"dan *f.is.*

**QINCANMAQ** *f.* Naz eləmək, nazlanmaq, özünü əzib-büzmək.

**QINDI** *is. məh.* Süddə bişən sıyıq un xörəyi, horra.

**QINDIRĞA** *məh.* 1. *is. bot.* Quraqlıq yerlərdə bitən nazik, uzun, tikanlı ot.

2. *sif.* Bir-birinə yapışmış, dolaşıq, kilkə. *Qındırğa saç* (*yun*).

3. *sif.* Həddən artıq bərk, quru.

**QINIF** *is. məh.* Bitkilərin yeməli tumlarının qabığı, qını.

**QINLI** *sif.* Qını olan. [Buğacın] *..belində zərif nəqşli tirmə qurşağa taxılmış, ağ şirmayı dəstəkli, qırmızı qınlı bir bıçaq .. var idi.* M.Rzaquluzadə. *Musa belinə uzun və qara qınlı xəncərini bağlayıb Sultanbuda yola düşdü.* Ə.Vəliyev.

**QINVARİ** *sif.* Qına oxşar, qınşəkilli, qın kimi.

**QIPÇAQLAR** *cəm, tar.* XI-XII əsrlərdə cənubi rus torpaqlarını tutmuş, peçeneqlərə yaxın türkdilli xalq. *Əya kim qulların qoçdur, Nəsimi qamudən kəmtər; Bəsa türkü, bəsa qıpçaq, bəsa zənci, bəsa hindu.* Nəsimi. *Son illərdə bir neçə basqında burunları yaxşıca ovulmuş qıpçaqlar çoxdan bəri buralara üz çevirmirdilər.* M.Rzaquluzadə.

**QIPIQ** *sif.* Yarıörtülü, yarıyumulu, tam açıq olmayan (göz haqqında).

**QIPQIRMIZI** *sif.* 1. Tünd-qırmızı, çox qırmızı, lap qırmızı. *Qıpqırmızı alma.* – *..Bu adamın üzü ətli, yanaqları qıpqırmızı, vücudu sapsağlam idi.* A.Şaiq. *Qıpqırmızı don geyindi ellərim; Qaranlığı boğazlayıb doğdu gün.* S.Rüstəm. ◻ **Qıpqırmızı kəsilmək** – utanaraq üzü qızarmaq. *Bu əsnada Kiçikbəyim içəri girdi, Vaqifi görüb utanaraq özünü itirdi. Qıpqırmızı kəsilib salam verdi..* Çəmənzəminli. **Qıpqırmızı olmaq (qızarmaq)** – utanaraq, yaxud acıqdan, pərtlikdən, həyəcandan sifəti qızarmaq. *Zavallının iztirabı artmışdı və üz-gözü qıpqırmızı olmuşdu.* B.Talıblı. *Zeynəbin yanaqları qıpqırmızı qızarmışdı; ürəyi də əsirdi.* Qantəmir.

2. *məc. dan.* Tamamilə, apaçıq, açıqdan-açığa, qabacasına. *Qıpqırmızı yalan.*

3. *zərf* Həyasızcasına, utanmazcasına, yalandan. *Qıpqırmızı üzünə durmaq. Qıpqırmızı danışmaq.*

**QIPQIZIL** *sif.* Çox qırmızı, tünd-qırmızı.

**QIPMA** "Qıpmaq"dan *f.is.*

**QIPMAQ** b a x **qırpmaq**.

**QIR**[1] *is.* 1. Neft qalıqlarından hazırlanan, damlara, səkilərə və s.-yə salınan qara rəngli qatı maddə. *Qır salmaq. Qır tiyanı.* – *Hava .. qır qoxusu ilə dolub daha da ağırlaşırdı.* Ə.Əbülhəsən.

2. Qəlyanın, müştükün içində və s. tüstü çıxan yerdə əmələ gələn qəliz maddə. *Çubuğun qırını təmizləmək.*

3. Kül rənginə çalar ağ, çal. *Çal qış! Buyur, uğur olsun! Qır saçını cinlər yolsun.* Ə.Cavad. // Tünd boz rəng.

**QIR**[2] *is. köhn.* Düzən, çöl. *Cənnət qoxan qırlar, əngin obalar; Bir atlazdır, yaşıl ucu görünməz.* A.Şaiq.

**QIR**[3] *is.* Dayaz quyudan su çəkmək və ya başqa məqsədlər üçün bir ucu qarmaq şəklində ağac və s. *Qır ilə quyudan su çəkmək. Qır ilə ağacın başındakı meyvələri dərdim.* – *Yelkən xurma yarpaqlarından toxunmuş və qır ilə möhkəmlənmiş dəyirmi bir yelkən idi.* M.S.Ordubadi.

**QIR**[4] *is. dan.* Naz, qəmzə, şivə. ◻ **Qır vermək (satmaq)** – nazlanmaq, naz eləmək.

**QIRA** *is. məh.* Təndirdən çörəyi qoparmaq üçün qarmaqlı alət. // Qarmaq. *..Küçədə qıradan tutub dartanda məftilin vasitəsilə zəng içəridə tərpənir, ciringildəyirdi.* Ə.Əbülhəsən.

**QIRACAQ** *is.* Nallanan atın dırnağını kəsib hamarlamaq üçün alət. *Nalbənd qıracaqla atın dırnağını kəsdi.*

**QIRAQ** *is.* 1. Bir şeyin kənarı, həddi, son xətti, yan tərəfi, yanı. *Stolun qırağı. Bağlar yol qırağı ilə uzanıb gedir.* – *Sağ əlimi masanın qırağına dayayıb durdum.* A.Şaiq. *Firidun xırmanın qırağında hələ döyülməmiş buğda tayasının yanında uzanmışdı.* M.İbrahimov. ◻ **Özünü qırağa vermək** – kənara çəkilmək, bir yana çəkilmək. // Haşiyə, kənar. *Bezin qırağı. Xalçanın qırağı.* – *Qırağına bax, bezini al.* (Ata. sözü).

2. Sahil, kənar. *Balıqçılar qayıq ilə qırağa çıxdılar. Dəniz qırağında gəzmək.* – *Gözüm yollarda qalmışdır; Xəbər yox Kür qırağından.* S.Vurğun.

3. *sif.* Kənar, yad, özgə. *Stolun başında bir nəfər də olsun qıraq adam yox idi.* M.S.Ordubadi.

**QIRAQ-BUCAQ** *is.* 1. Kənar, ətraf, yan-yörə. [Kərəmov:] *Kağız çatışmır, köhnə protokolların qıraq-bucağına yaz.* S.Rəhman.
2. Ətraf yer, kənarda olan yer.

**QIRAQDAN** *zərf* Kənardan. *Qıraqdan baxanlar müəllimin qorxaqlığına gülmüşdülər*. Mir Cəlal.

**QIRAQLAMAQ** *f.* Bir parçanın və s.-nin qıraqlarını kəsib düzəltmək. // Bir şeyin ətrafını, kənarlarını bərkitmək, başqalarından ayırmaq.

**QIRAQLI** 1. *sif.* Qırağı, kənarı olan.
2. *is. məh*. Su qırağında (sahilində) yaşayan adam.

**QIRBA(N)C** b a x **qırma(n)c**. *Əməlli-başlı tənbəlləşən at, bir xeyli qırbanc yedikdən sonra götürüldü*. Ə.Əbülhəsən.

**QIRBA(N)CLAMA** "Qırba(n)clamaq"dan *f.is.*

**QIRBA(N)CLAMAQ** b a x **qırma(n)clamaq**. *..Güllünü bu dəfə də himayə edərək, Ballının üzərinə atılıb qırbaclarkən, Səfər artıq dayanmadı.* A.Şaiq.

**QIRBASAN** b a x **qırçı**. [Köhnə Bakıda] *ümumiyyətlə peşəkarlar: bənna, xarrat, dəmirçi, qırbasan .. və sairə çox olardı.* H.Sarabski. *Doğrudur, mənim gəlinim yəhudidən, .. urusdan yaşınmır, dəlləkdən, qalayçıdan, qırbasandan çəkinmir. Amma öz qohum-qardaşlarımızdan .. həya-ədəb eləyir*. Qantəmir.

**QIRBİŞİRƏN** b a x **qırçı**.

**QIRÇI** *is.* Qır bişirən, qır salan usta.

**QIRÇILIQ** *is.* Qırçı sənəti, qırçı peşəsi.

**QIRÇIN** *is.* 1. Paltarda və s.-də qırışıq şəklində naxış. *Paltarın qırçını. – Paltarın üst hissəsinin kiçik büzmələrini və qırçınlarını tikdikdən sonra, kürək hissə ilə döş hissə bir-birinə bənd edilir*. "Az. qad.". // Qabların və s.-nin dövrəsində, kənarlarında diş-diş şəklində bəzək.
2. *bot*. Bəzi ot bitkilərdə yarpaqların kökə yaxın hissəsindən çıxması.

**QIRÇIN-QIRÇIN** *zərf* və *sif.* Qırçınlar halında, qırış-qırış. *Tumanın uzun balağı qırçın-qırçın olub stulun oturacaq yerindən aşağı sallanır,* [Sonanın] *al məxmərdən geydiyi yumşaq başmağına toxunurdu*. Ə.Əbülhəsən.

**QIRÇINLAMA** "Qırçınlamaq"dan *f.is.*

**QIRÇINLAMAQ** *f.* 1. Qırçın-qırçın etmək.
2. Burub arasına salmaq. [Zöhrə] *..birçəklərini qoçbuynuzu burdu, sonra balaca darağı ilə telini darayıb birçəklərinin arasında qırçınladı.* Ə.Vəliyev.

**QIRÇINLANMA** "Qırçınlanmaq"dan *f.is.*

**QIRÇINLANMAQ** *məch.* Qırçın-qırçın edilmək.

**QIRÇINLI** *sif.* Qırçınları olan. *Qırçınlı paltar. Qırçınlı məcməyi. – Kiçik balkona qoyulmuş qırçınlı ağ samovar şaqqaşaq ilə qaynayırdı.* S.Rəhimov.

**QIRÇINMAQ** *f. məh*. İncimək, dözməmək, sınmaq. [Şeyxsəlim] *varlığını hiss etmirdi, çünki ona daş dəydikdə belə deyəsən, incimir və qırçınmırdı*. M.S.Ordubadi.

**QIRÇ, QIRÇ-QIRÇ** *təql.* Dişlərin bir-birinə sürtülməsindən çıxan səs.

**QIRDIRILMAQ** "Qırdırmaq"dan *məch*.

**QIRDIRMA** "Qırdırmaq"dan *f.is.*

**QIRDIRMAQ** *icb.* 1. Qırmağa, sındırmağa, kəsməyə məcbur etmək. *Molla Güləndam bacı da düşmənin pəncərəsini mütəllimələrə qırdırıb və həyatinə qayıtdı.* Çəmənzəminli. *Qaraca çoban qəsdən buranı seçmişdi. Hələ gecə ikən meşədən iri gövdəli əsrdidə ağaclardan qırdırdı.* M.Rzaquluzadə.
2. Qırılmasına səbəb olmaq, vasitə olmaq.

**QIRĞI** *is. zool.* Balaca quşları ovlayan iti və uzun caynaqlı, qısa qarmaq dimdikli yırtıcı quş. *Qırğı yuvası. – Sərçəni bir qırğı edərkən şikar; Bir tələyə oldu qəzadan düçar*. A.Səhhət. *Bir azdan sonra qırğı göründü. Çil xoruz qışqırıq saldı. Qırğı dayanmayıb keçdi.* S.S.Axundov. ☐ **Qırğı kimi** – 1) çox qıvraq, əl-ayaqdan iti və zirək. [Əlyarov:] *Nənə!.. Lap qırğı kimisən! Oğuldan, uşaqdan nəyin var?* M.Hüseyn; 2) çox cəld, çox iti, tez, əlüstü, bir anda. *Qırğı kimi başının üstünü almaq. – Fatma qırğı kimi özünü təndirə toxuyur, kəhrəba kimi sarı çörəkləri əlində çıxarıb, .. süfrənin üstünə atır.* Mir Cəlal. *Sərvnaz Poladın eyhamını eşidincə, belini düzəltdi. Qırğı kimi şığıyıb, özünü traktora çatdırdı.* Ə.Vəliyev.

**QIRĞIBURUN(LU)** *sif.* Burnunun ortası çıxıq, ucu isə getdikcə nazikləşərək aşağı əyilmiş.

**QIRĞIN** *is.* 1. Heyvanların, mal-qaranın, ev quşlarının kütləvi surətdə qırılıb tələf olmasına səbəb olan yoluxucu xəstəlik. *Heyvanlara qırğın düşmək.*

2. Böyük insan tələfatı; bu cür tələfata səbəb olan qanlı vuruşma, müharibə; bir-birini qırma. *İkinci dünya müharibəsi böyük qırğına səbəb oldu. Son dünya müharibəsinin dəhşətlərini görən bəşəriyyət yeni qırğının qəti əleyhinədir.*

3. *məc.* Dava-dalaş, dalaşma, vuruşma, söyüşmə. [Səlimnaz xanım:] *Mən bu evə gələn beş ay deyil, yüz yol bu evdə qırğın olub.* N.Vəzirov.

**QIRĞIOTU** *is. məh. bot.* Dağlarda, çəmənlərdə, kolluqlarda bitən çoxillik ot bitki.

**QIRĞIZ** *is.* Qırğızıstanın əsas əhalisini təşkil edən türkdilli xalq və bu xalqa mənsub adam.

**QIRĞIZCA** *sif.* və *zərf* Qırğız dilində. *Qırğızca dərs kitabı. Qırğızca danışmaq.*

**QIRHAQIR** *is.* Kütləvi surətdə qırma, öldürmə, məhv etmə; qırğın. *Səmada, torpaqda düşür qırhaqır; Yerdən alov yağır, göydən od yağır.* M.Rahim.

**QIRX** *say.* 1. Otuz doqquzdan sonra gələn say, 40 ilə işarə olunan rəqəmin adı. *Qırx manat. Qırx ədəd. – Qırxında öyrənən gorunda çalar.* (Ata. sözü).

2. Bir şəxsin ölümünün qırxıncı günü. ☐ **Qırx bağla(t)maq** – xalq adətincə ölən adamın qırx günü tamam olandan sonra ehsan verib yas məclisini bitirmək. **Qırx saxlamaq (tutmaq)** – xalq adətincə ölü üçün qohum-qardaşının qırx gün yas saxlaması. **Qırx vermək** – xalq adətincə ölən adam üçün qırxıncı gün ehsan vermək. **Qırxı çıxmaq** – xalq adətincə ölən adam üçün saxlanılan yasın qırx gündən sonra qurtarması.

◊ **Qırx kötük** *dan.* – qış qurtardıqdan sonra davam edən şaxta, soyuq. **Qırxında yorğalamaq** – çox yaşlı olduğu halda, cavanlıq fikrinə düşmək, yaşına yaraşmayan hərəkətlərdə olmaq.

**qırx...** – bu sayla əlaqədar olan bir sıra mürəkkəb sözlərin birinci tərkib hissəsi; məs.: qırxayaq, qırxillik, qırxgünlük, qırxdərəcəli.

**QIRXAYAQ** *is. zool.* 1. Çoxayaqlılar fəsiləsindən uzunsov çoxayaqcıqlı bir cücü.

2. *dan.* Xərçəng. *Bu çinovniklər qorxuram ki, sabah gəlib bunu desinlər ki, sabah badımcan dolması əvəzinə qırxayaq* (*xərçəng*) *şorbası içəsiniz. Onda bilmirəm necə olacaqdır?* Ü.Hacıbəyov. *Gəminin hər iki tərəfindən qırxayağın ayaqları kimi suya uzanan kürəklər enib-qalxır.* M.Rzaquluzadə.

**QIRXBAYIR** *is.* Gövşəyən heyvanlarda üçüncü və ehtiyat mədəsi.

**QIRXBUĞUM** *is. bot.* Əsasən dağlıq yerlərdə bitən, xörəyə qatılan ətirli bir bitki. *Beşi də böyrünü yerə vermiş, yenicə bitmiş qırxbuğumdan qıraraq ağızlarına qoyur və çeynəyirdilər.* Ə.Vəliyev.

**QIRXÇƏLLƏK** *is.* Quyudan su çəkmək üçün hərəkət edən lentə, ya zəncirə bənd edilmiş çanaqlardan ibarət alət.

**QIRXDAMAR** *sif. dan.* 1. Canı bərk, davamlı, dözümlü (adam haqqında).

2. Qatları, damarları çox olan (torpaq haqqında).

**QIRXDIRILMA** "Qırxdırılmaq"dan *f.is.*

**QIRXDIRILMAQ** *icb.* Başında, üzündə, yaxud bədənində olan tüklər ülgüc və ya qayçı ilə dibindən kəsdirilmək. *Qoyunlar qırxdırılmışdır.*

**QIRXDIRMA** "Qırxdırmaq"dan *f.is.*

**QIRXDIRMAQ** *icb.* Başında, üzündə, yaxud heyvanın bədənində olan tükləri dibindən kəsdirmək. *Başını qırxdırmaq. Saqqalını qırxdırmaq. Qoyunları qırxdırmaq.* – [Nadir] *bu nədir saçını qırxdırmısan? – deyə acıqlı-acıqlı sordu və o saat Zeynəbin uzun və xurmayı saçlarını gözünün önünə gətirdi.* B.Talıblı. *Səlim şıx geyinmiş, üzünü təzəcə qırxdırmışdı.* M.İbrahimov.

**QIRXDİLLİ** *sif. dan.* Hamıya söz verən, hamını aldadan; riyakar, ikiüzlü. *Qırxdilli adam.*

**QIRXDON** *is. məh. bot.* Gövdəsi soğan kimi qat-qat olan, qırmızı gül açan, yeyilən bir bitki.

**QIRXIQ** *sif.* Qırxılmış. *Qırxıq üz. Qırxıq baş. – Yuxarıdan düşən, işıq ..* [miyandarın] *qırxıq başını işıldadırdı.* Çəmənzəminli. [Dəllək:] *Qoy bu topuşu bir üç yaşar quyruğu qırxıq dayçaya döndərim, sonra Ələmdar qardaşın qulluğunda amadə dayannam!* S.Rəhimov.

**QIRXILI** *sif.* Qırxılmış.

**QIRXILIQ** 1. *sif.* Qırxılmağa yararlı, qırxılmalı olan, qırxılmaq üçün ayrılmış, qırxılmaq vaxtı çatmış. *Qırxılıq qoyun. Qırxılıq keçi.*

2. B a x **qırxlıq²**.

**QIRXILMA** "Qırxılmaq"dan *f.is.*

**QIRXILMAQ** *məch.* Ülgüc və ya qayçı ilə dibindən kəsilmək (saç, tük). *Başı qırxılmaq. – Bəli, başlar başlayıblar qırxılmağa. Dəllək dükanlarında macal yoxdur*. C.Məmmədquluzadə. // Qırxıqla kəsilmək, qayçılamaq. *Qoyunlar qırxılmışdır.*

**QIRXILMIŞ** *f.sif.* Tükü ülgüc və ya qayçı ilə dibindən kəsilmiş; qayçılanmış, qırxılı. *Qırxılmış baş. Qırxılmış qoyun. – Qışda şiddətli soyuq təsirindən qırxılmış başlar donub nə ölü olurlar, nə diri.* C.Məmmədquluzadə. [Almurad] *qırxılmış başının tərini sildi*. İ.Əfəndiyev.

**QIRXIM** *is.* 1. Bir dəfədə qırxılan yun.

2. Qoyunların qırxılması mövsümü, qoyunlar qırxılan vaxt, qoyunların qırxılması işi.

**QIRXIN** b a x **qırxım**.

**QIRXINCI¹** *is.* Qoyun qırxan adam.

**QIRXINCI²** "Qırx"dan sıra sayı. *Qırxıncı nömrə. Qırxıncı illər. Qırxıncı gün. Qırxıncı il.*

**QIRXINTI** *is.* Bir şeyin kənarlarından, ya uclarından kəsilib atılan qırıntılar.

**QIRXLIQ¹** *sif.* Qırx rəqəmi ilə əlaqədar olan ölçü; məs.: qırxlıq qazan, kisə və s. (qırx girvənkə, ya qırx kilo tutan qazan, kisə və s.); qırxlıq çəllək (qırx vedrə su və ya başqa maye tutan çəllək); qırxlıq dirək (qırx arşın, ya metr uzunluğunda olan dirək); qırxlıq lampa (qırx vatlıq lampa).

**QIRXLIQ²** *is.* Qoyunları qırxmaq üçün xüsusi qayçı.

**QIRXMA** "Qırxmaq"dan *f.is.*

**QIRXMAQ** *f.* 1. Üzündəki, başındakı və ya bədəninin başqa yerlərindəki tükləri ülgüc və ya qayçı ilə dibindən kəsmək. *Üzünü qırxmaq. Dəllək başımı qırxdı. – ..Usta bir müştərinin başını qırxıb qurtarıb qanatdığı yerlərə pambıq düzürdü*. C.Məmmədquluzadə. *Tütünçüoğlu ülgüc və qayçını çıxarıb Molla Qurbanın bığlarını və saqqalını qırxdı.* M.S.Ordubadi.

2. Qoyunun yununu qayçı ilə dibindən kəsmək, qayçılamaq.

**QIRXYARPAQ** *is. məh. bot*. Çoxyarpaqlı, xırda gül açan ot bitki.

**QIRICI** *sif.* 1. Qıran, məhv edən, qırıb tələf edən, öldürücü. *Həşərat qırıcı vasitələr.*

2. Düşmən gəmi və təyyarələrini məhv etmək, düşmən diversantları və s. ilə mübarizə etmək vəzifəsini daşıyan. *Qırıcı aviasiya. Qırıcı dəstələr. Döyüş təyyarələrinin bir növü qırıcı təyyarələrdir. – Kənd içində qırıcı batalyon keşikçisindən başqa kimsə görünmürdü*. Ə.Əbülhəsən. // *is.* Qırıcı təyyarə. *Qırıcılarımızın o birisi qəsəbənin üzərində hərlənir və yoldaşının keşiyini çəkirdi.* Ə.Vəliyev.

**QIRIQ** *sif.* 1. Qırılmış, kəsilmiş. *Qırıq ip. Qırıq məftil.*

2. Rabitəsiz, əlaqəsiz. *Qırıq cümlə.*

3. Sınıq, sınmış. *Qırıq kasa. Qırıq şüşə. – Sarxan əlindəki qırıq fənəri yuxarı qaldırdı.* M.Hüseyn. *Yelkənlər qırıq quş qanadı kimi cansız bir hərəkətlə yırğalanırdı*. M.Rzaquluzadə. *Təsərrüfatçı ona* [Qədirə] *qırıq bir taxt göstərib dedi:* "*Hələlik ötüş*". Mir Cəlal. // Yaramaz, dəyərsiz, sınıq. *Yaxşı ki, dədəm Qafar sənə bu qırıq tüfəngi qoyub getmişdir.* A.Şaiq.

4. *is.* Qırılmış, sındırılmış, parçalanmış şeyin kiçik parçası, tikəsi. *Şüşə qırığı. Qənd qırığı. İp qırığı. – Gülsüm xala .. barmağını uşağın ağzına salıb, əzgil çəyirdəyindən, gavalı çəyirdəyindən, kömür qırığından çıxarırdı*. Ə.Haqverdiyev. // Tullantı; qırıntı. *Kağız qırıqları. Papiros qırığı.*

5. "Bir" sözü ilə: **bir qırıq** – bir tikə, bir az, bir zərrə. *Bir qırıq çörək.*

6. *məc.* İncimiş, sınmış. *Qırıq könül.*

**QIRIQÇI** *dan.* b a x **sınıqçı**.

**QIRIQÇILIQ** *dan.* b a x **sınıqçılıq**.

**QIRIQ-QIRIQ** *sif.* və *zərf* Tikə-tikə, parça-parça. *Qırıq-qırıq xətt. Qırıq-qırıq olmaq.* // Rabitəsiz. [Ustalar] .. *arabir danışır, qırıq-qırıq fikirlər və mülahizələr yürüdürdülər*. Çəmənzəminli. [Sübhanverdizadə] ..*Nemətullayev ilə bir növ qırıq-qırıq danışır və cavab verirdi*. S.Rəhimov. *Gülşən bir qədər sükutdan sonra, qırıq-qırıq danışmağa başladı.* Ə.Vəliyev.

**QIRIQ-QURAQ** *sif.* Qırıq parçalardan ibarət olan.

**QIRIQ-QURUQ** *dan.* bax **qırıq-sökük** 2-ci mənada.

**QIRIQLIQ** *is.* 1. Qırıq şeyin halı; sınıqlıq.

2. Əzginlik, ağrı, sızıltı. *Bütün vücudumda bir qırıqlıq, bir sızı hiss edirəm.* A.Şaiq.

**QIRIQ-SÖKÜK** *dan.* 1. *sif.* Rabitəsiz, dağınıq.

2. *sif.* Dağılmış, sökülmüş, sınıq.

3. *is.* Qırıntı, söküntü, tullantı.

**QIRIQ-TÖKÜK** bax **qırıq-sökük** 1 və 2-ci mənalarda.

**QIRILDAMA** "Qırıldamaq"dan *f.is.*

**QIRILDAMAQ** *f.* Qır-qır etmək, qırıltı səsi çıxarmaq. *Qarğa qırıldayır. – Mırt-mırt oxuyub mırıldayırsan; Qarğa kimi hey qırıldayırsan.* M.Ə.Sabir.

**QIRILDAŞMA** "Qırıldaşmaq"dan *f.is.*

**QIRILDAŞMAQ** *qarş.* 1. Səs-səsə verib qır-qır etmək, qırıldamaq. *Qarğalar qırıldaşır. – Hərə bir tərəfdən qırıldaşırdı.* S.Rəhman.

2. *məc.* Hərə öz yerindən danışmaq, arası kəsilmədən nə isə demək. *Kəndlilər Əmrahın gülləsi ilə ölən pristava söyüş yağdırıb, hər tərəfdən qırıldaşmağa başladılar.* M.Hüseyn.

**QIRILDATMA** "Qırıldatmaq"dan *f.is.*

**QIRILDATMAQ** *f. dan.* Uzun danışmaq, mənasız danışmaq, çox danışmaq. [Ələmdar:] *Ədə, boş-boş qırıldatma!* S.Rəhimov.

**QIRILMA** "Qırılmaq"dan *f.is.*

**QIRILMAQ** *f.* 1. Kəsilmək, kəsilib ayrılmaq, qopmaq, qopub düşmək. *İp qırıldı. Düymə qırılıb düşdü. – ..Taxılın sünbülləri ayaq üstə durduğu yerdə bilmirsən nədənsə qırılıb düşür yerə.* C.Məmmədquluzadə.

2. Birdən kəsilmək, əlaqə kəsilmək. *Söhbət ortada qırıldı. Əlaqə qırıldı.*

3. Sınmaq, parçalanmaq, tikə-tikə olmaq. *Pəncərənin şüşəsi qırıldı. Qablar əlindən düşüb qırıldı. Saat düşüb qırıldı. – İnək qoca idi. Bir buynuzu da dibindən qırılmışdı.* C.Məmmədquluzadə. *Qılıncı qırılmış, papağı itmiş polis nəfərləri tələdən qurtulmuş tülkü kimi qaçırdılar.* M.S.Ordubadi.

4. *məc.* İncimək, sınmaq, xatirinə dəymək. *Qəlbi qırılmaq. Könlü qırılmaq.*

5. Kütləvi surətdə tələf olmaq, məhv olmaq, ölmək. *Quşlar soyuqdan qırıldı. Görülən tədbirlər nəticəsində siçanların hamısı qırıldı.* – [Üçüncü kəndli:] *Bir üç il bundan irəli kəndə "xalyar" naxoşluğu düşmüş idi, nə qədər adam qırıldı.* Ə.Haqverdiyev. [Pirqulu:] *Onsuz da ki acından ölürük, qoy birdəfəlik qırılaq.* C.Cabbarlı.

6. Ağrımaq; sümüklərdə ağrı, sızı, əzginlik hiss etmək. *Bədənim bütün qırılır. – Onun sümükləri qırılırdı. Bir qədər də yorğana büründü, titrəməyə düşdü.* S.Rəhimov.

**QIRILMAZ** *sif.* Möhkəm, sarsılmaz, pozulmaz; əbədi. *Qırılmaz əlaqə. Qırılmaz dostluq.* – [Toğrul] *qırılmaz bir iradə qüvvəsi ilə və qəvi barmaqlarını sıxıb, eşidilən bir səslə: – Hər nə olursa olsun, səbat lazımdır, – dedi.* H.Nəzərli. *Ürəkdən-ürəyə xəbər aparan iki dost, iki məslək yoldaşı arasında qırılmaz əlaqə yaradan mehriban bir nəzərlə bir-birinə baxdılar.* M.İbrahimov.

**QIRILMAZLIQ** *is.* Qırılmaz şeyin halı; möhkəmlik, sarsılmazlıq.

**QIRILMIŞ** *f.sif.* 1. Kəsilmiş, üzülüb ayrılmış, qopmuş, qopub düşmüş. *Adamlar daş pilləkənlərdən təmiz küçəyə enəndə qırılmış boyunbağı kimi səpələnib dağılırdılar.* Mir Cəlal.

2. Sınmış, parçalanmış, tikə-tikə olmuş. *Qırılmış boşqablar.*

3. *dan.* Qarğış, söyüş mənasında.

**QIRILTI** *is.* 1. Qarğanın, sağsağanın çıxardığı səs.

2. İki sərt şeyin bir-birinə sürtülməsindən çıxan səs. // Arası kəsilməyən qarışıq, anlaşılmaz səs. *Qırıltıdan baş-qulağımız getdi.*

**QIRIM** *is. dan.* Görkəm, təhər-töhür, görünüş, hal, əhval, tövr. *Baxdım ki, munun qırımı özgə; Mənimlə alım-verimi özgə.* Xətayi.

**QIRIM-QIRTI(Q)** *sif. dan.* Qırıq, qırıntı, töküntü, tullantı.

**QIRINTI** *top.* Qırılan, sındırılan, doğranan, kəsilən bir şeydən ayrılan xırda parçalar, hissələr, qırıqlar, tikələr; tullantı; xırım-xırda. *Çörək qırıntısı. Daş qırıntısı. Ağac qırıntısı. Yun qırıntısı.* – [Alacəhrə] *damın içində dəndən tutmuş çörək, qənd qırıntılarına kimi nə düşürdü, dimdikləyib yeyirdi.*

S.S.Axundov. *Əjdər üstünə tökülmüş çörək qırıntılarını çırpıb ayağa qalxdı.* S.Rəhman.

**QIRIŞ** *is.* 1. Bir şeyin büküldüyü, qatlandığı yerdə qalan iz; bükük yeri, bürüşük. *Paltarın qırışlarını ütü ilə düzəltmək.*

2. Üz, bədən dərisində və s.-də əmələ gələn dərin cizgi, qırışıq. *Qəhrəman aralandıqca Nubar qarının qara və qırış* (sif.) *sifətini daha yaxşı görür.* S.Rəhimov. *Məşədibəy cavab vermədi. Onun üzündəki qırışlar daha da sıxlaşdı.* M.Hüseyn. [Maralın] *alnının ortasındakı qırış açıldı.* Ə.Əbülhəsən. // Yer qabığı laylarında əmələ gələn dərin qırışıq. [Tektonik] *qüvvələrin təsirindən laylar müxtəlif qırışlara çevrildi.* M.Qaşqay.

◊ **Üzündəki qırışlar (üzünün qırışları) açılmamaq** – ürəyi açılmamaq, qaşqabağı açılmamaq, üzü gülməmək. *Lotuoğlu məclisin ortasına çıxıb bir çox gülməli oyunlar çıxardısa da, xanın üzündəki qırışların biri də açılmadı.* Çəmənzəminli.

**QIRIŞDIRMA** "Qırışdırmaq"dan *f.is.*

**QIRIŞDIRMAQ** *f.* Qırışıq hala salmaq, büzüşdürmək, əzik-büzük hala salmaq. *Paltarı qırışdırmaq. – Onun* [Muradın] *saçlarını ağardan, üzünün dərisini qırışdıran yarım əsrlik bir həyat idi.* S.Hüseyn. *Bostançı alnını qırışdırıb göy səmtinə baxdı.* S.Rəhimov.

**QIRIŞIQ** 1. B a x **qırış**. *Köynəyin qırışığını aç. Süfrənin qırışığı. – Yeməyə-içməyə etina qalmır; Heç alnının qırışığı açılmır.* A.Səhhət. *Polkovnikin alnındakı qırışıqlar sıxlaşdı.* M.İbrahimov.

2. *sif.* Qırışmış, büzüşmüş, büzük yeri qalan. *Qırışıq paltar. Qırışıq süfrə. Qırışıq yaylıq. – ..Xatın gülümsündü, onun qırışıq yanaqlarından üzüaşağı sevinc yaşları axmağa başladı.* S.Rəhimov.

**QIRIŞIQLI** *sif.* Qırışıqları olan, qırış-qırış. *Qoca adamların dərisi quru, cod, qırışıqlı olur.*

**QIRIŞIQLIQ** *is.* Qırışıq şeyin halı.

**QIRIŞMA** "Qırışmaq"dan *f.is.*

**QIRIŞMAQ** *f.* 1. Qırışlar əmələ gəlmək, qırış-qırış olmaq, büzüşmək, büzük-büzük olmaq, yığışmaq, qırış halına düşmək. *Üzü qırışmaq. – Onun alnı qırışmışdı, qaşları az qala gözlərini bürümüşdü.* Ə.Vəliyev.

2. Yığılmaq, qırışıb gödəlmək.

**QIRIŞ-QIRIŞ** *sif.* və *zərf* Qırışları çox olan, qırışıq halda olan, hər tərəfi qırışmış. *Köynəyi qırış-qırış etmək. Alnı qırış-qırış olmuşdur.*

**QIRIŞMAL** *is. dan.* Zarafat tərzi ilə söylənən yüngül söyüş ifadəsi. [Qənbər:] *..Bax, bu qırışmal Zaman da oturmuşdu yanımızda.* C.Məmmədquluzadə. *Qubernator deməzdimi ki, ay qırışmal, bu vurhavurda heç olmazsa libasla kim olduğunu niyə göstərmirsən?* S.Rəhimov.

**QIRIŞMIŞ** *f.sif.* Qırışıq hala gəlmiş, qırış-qırış olmuş. *Hər kəs Bədircahanın qırışmış üzünə baxsaydı, yəqin ki, sual edərdi öz-özündən, görəsən, bu zənən nə fikir edir?* N.Vəzirov. *Tapdıq ..* [anasının] *qırışmış üzgözünü öpüşlərə qərq etdi.* Ə.Əbülhəsən.

**QIRIŞSİFƏT** *sif.* Sifətinin dərisində çoxlu qırışıq olan. [Oğlan] *qəribə bir iştibahla uzunburun, sallaqbığ, qırışsifət, uzunqılça adama nəzər saldı.* S.Rəhimov.

**QIR-QIC** *is.* b a x **qıc**. *Gözündən qan damırdı, əlində yalın qılınc; Yaxınlaşıb Əliyə, yapışdı, oldu qır-qıc.* R.Rza.

**QIR-QIR** *təql.* Qarğanın çıxardığı səs; qırıltı. *Qır-qır etmək. – Sübh olunca gecələr darğa kimi; Yatmayır, qır-qır edir qarğa kimi.* M.Ə.Sabir.

**QIR-QIRA** *is. məh.* Qır-qır səs çıxaran uşaq oyuncağı.

**QIRQOVUL** *is. zool.* Toyuq fəsiləsindən rəngarəng tüklü, ləzzətli əti olan iri ov quşu. *Qırqovul ovu. – Kənd ovçuları yanlarında ov itləri qırqovul, turac ovuna çıxarlar.* Z.Xəlil.

◊ **Qırqovul kimi başı kolda olmaq** – qafil olmaq, ətrafında baş verən hadisələrdən xəbəri olmamaq.

**QIRQOVULLUQ** *is.* Qırqovul bol olan yer.

**QIRLAMA** "Qırlamaq"dan *f.is.*

**QIRLAMAQ** *f.* 1. Qır döşəmək, qır salmaq, qır ilə örtmək. *Damı qırlamaq. Səkini qırlamaq.*

2. B a x **qırlanmaq** 2-ci mənada. *Müştükün içi qırlayıbdır.*

3. *dan.* Yeni doğulmuş uşağın birinci günlərində qeyri-adi surətdə bayıra işləməsi, qır kimi ifraz etməsi.

**QIRLANĞIC** *is.* Qaranquş. *İki yolçu sevimli qırlanğıc; Ötüşüb bir budaqda şən:* "*vic-vic*". A.Şaiq. *Tramvaylar sularda süzən qırlanğıc kimi axır.* Mir Cəlal.

**QIRLANMA** "Qırlanmaq"dan *f.is.*

**QIRLANMAQ** 1. *məch.* Qır döşənmək, qır salınmaq, qırla örtülmək. *Damlar qırlandı. Həyət qırlandı.*

2. *qayıd.* Hislənmək, qurumlanmaq; qurumla, his ilə dolmaq; qurum bağlamaq (baca, müştük və s.).

**QIRLAŞMA** "Qırlaşmaq"dan *f.is.*

**QIRLAŞMAQ** *f.* 1. Qır halına düşmək.

2. *məc. dan.* Bərk-bərk yapışmaq, tutmaq. *Qönçə əsla Həbibdən ayrılmır. Gör necə qırlaşıb qucağına, elə bil doğma atasıdır.* Ə.Vəliyev.

**QIRLATMA** "Qırlatmaq"dan *f.is.*

**QIRLATMAQ** *icb.* Qır saldırmaq, qır döşətmək, qırla örtdürmək. *Damı qırlatmaq.*

**QIRLI** *sif.* Qır salınmış, qır döşənmiş, qırla örtülmüş. *Qırlı səki.* – [Ələmdar] *..qırlı damların üstündən içərinin görünüb-görünmədiyini bilmək istədi.* S.Rəhimov.

**QIRMA[1]** *is.* 1. "Qırmaq"dan *f.is.*

2. Ov tüfəngindən atılmaq üçün qurğuşundan tökülən xırda kürəciklər; seçmə. *Bu tüfəng qırmanı çox yayır. Qırma ilə doldurulmuş patron.* **Qırma tüfəngi** – qırma atan quş tüfəngi, ov tüfəngi.

3. *sif.* Qırma şəklində olan, xırda, xırda-xırda doğranmış. *Qırma daş.*

4. *məh.* Kiçik palıd ağacı, palıd kolu, yaxud bir boyda kəsilmiş çəkil ağacları.

5. *məh.* Bəzi ev heyvanlarının ağzında əmələ gələn səpgi, qabarcıq.

**QIRMA[2]** *sif.* Üstü qayçılanmış, qayçı ilə vurulmuş. *Qırma bığ, saqqal.*

**QIRMABADAM** *is.* Badam, fındıq və ya qoz ləpəsindən hazırlanan halva növü.

**QIRMABIĞ(LI)** *sif.* Bığının üstü qayçılanmış, qayçı ilə vurulmuş. *İri gövdəli, göy paltarlı, qırmabığlı Qocaoğlu kövşəndənbiçindən idarəyə qayıtdı.* S.Rəhimov. *Məmmədəlişah qaraqaş, qaragöz, qara qırmabığlı və qarayanız bir adam idi.* P.Makulu.

**QIRMAQ[1]** *f.* 1. Bərk bir şeylə vurmaqla, toxundurmaqla, yaxud yerə salmaqla parçalamaq, sındırmaq. *Güzgünü qırmaq. Qabları qırmaq.* – *Qız ..* [müəllimi] *görüncə şaşırıb üzünü örtməyə tələsdikdə, səhəngini salıb qırmışdı.* S.Hüseyn. *Ləpələr bu pillələri saxsı qab kimi vurub qırır.* Mir Cəlal. *Xan havalı kimi bu otaqdan o otağa qaçır, nərə çəkib yerindən qopur, rast gələn hər şeyi qırırdı.* M.Rzaquluzadə. // Doğramaq, bütöv bir parçanı xırda-xırda etmək. *Qəndi qırmaq. Daşı qırmaq.*

2. Balta və s. ilə kəsmək, doğramaq. *Meşəni qırmaq. – Getdi meşə içrə odun qırmağa; Şax-budağı başladı sındırmağa.* A.Səhhət. *Abbas .. meşədən odun qırıb satmaqla ana və bacısını saxlayır.* S.S.Axundov.

3. Kütləvi surətdə tələf etmək, məhv etmək, öldürmək. [Nəbi:] *Uşaqlar, fürsəti əldən buraxmışıq. Bizi tamam qıracaqlar!* "Qaçaq Nəbi". *..Bir şey yoxdur, amma qoyunlara bərk qızdırma düşüb, yaman qırır.* C.Məmmədquluzadə. *Onlar güman edirdilər ki, qarşılarına heç bir kimsə çıxmayacaq, .. bir neçə sarsaq çoban tərslik etmiş olsa, həmin saat onları qırıb minlərlə qoyunu asanlıqla sürüb aparacaqlar.* M.Rzaquluzadə. // Eyni mənada bəzən "qırıb tökmək", "qırıb çatmaq" və s. şəklində. *Bir neçə qadın sahəni gəzərək maşının götürə bilmədiyi alaq otlarını kətmənlə qırıb tökürdü.* M.İbrahimov. *İki tərəfdə əsirlərin ələ düşənini qırıb tərk etmişdilər.* Çəmənzəminli.

4. Kəsmək, üzmək, qət etmək. *Əlaqəni qırmaq. Rabitəni qırmaq. Məftili qırmaq.* // Yarımçıq qoymaq, kəsmək. *Kərimqulu sözünü qırıb, ara qapıdan nəvəsinin iniltisinə qulaq verdi.* S.Rəhimov.

5. *məc.* Sarsıtmaq, zəiflətmək, azaltmaq, yox etmək. *Günəş havanın şaxtasını qırdı. İnadını qırmaq. Nüfuzunu qırmaq. Müqavimətini qırmaq. – Rübabəyə qarşı bütün tədbirləri pozan bir qüvvə ..* [Gəldiyevin] *kirdarını alır, iradəsini qırır, heç bir şey eləməyə imkan vermirdi.* Mir Cəlal. *Nə boran, nə qar, nə də şaxta onların möhkəm iradəsini qıra bilməz.* Z.Xəlil.

6. *məc.* Bağlayan, məhkum edən bir şeydən xilas olmaq, azad olmaq. [Tapdıq:] *Qırıb zənciri-hicranı xilas olmaq əsarətdən.* C.Cabbarlı. [İnsanlar] *boğazlarına keçmiş fəlakət zəncirini qırıb atmağa heç bir yol və imkan tapa bilmirdilər.* Ə.Abasov.

**QIRMAQ[2]** b a x **qarmaq[1]**. *Üst-başı toz-torpaq içində qısaboylu .. iri çopur burnu qırmaq kimi əyri bir topal, yumaq kimi yumalana-yumalana içəri girdi.* M.Rzaquluzadə.

**QIRMA(N)C** *is.* Heyvanları sürərkən vurmaq üçün kirişdən, dəridən, ipdən və s.-dən qayrılan uzun dəstəli qamçı; şallaq, tatarı. *Salman kişi də arabanın boyunduruğuna oturdu, .. əlindəki uzun qırmancını havada bir neçə kərə şatlatdı.* A.Şaiq. *Faytonçu qırmancı havada yellədikdə atlar hərəkət etdi*. M.İbrahimov. *İndi Bağırın sağ əli olan Nüsrət əlində qırmanc qazılan anbarların yanında firlanırdı.* Ə.Məmmədxanlı.

**QIRMA(N)CLAMA** "Qırma(n)clamaq"dan *f.is.*

**QIRMA(N)CLAMAQ** *f.* Qırmancla vurmaq. *Atı qırmanclamaq. – Qırmanclayır atı, yortur, yüyürür; Bir dağı döndükdə böyük kənd görür.* A.Səhhət.

**QIRMA(N)CLANMA** "Qırma(n)clanmaq"-dan *f.is.*

**QIRMA(N)CLANMAQ** *f.* Qırmancla vurulmaq.

**QIRMA(N)CLATMA** "Qırma(n)clatmaq"-dan *f.is.*

**QIRMA(N)CLATMAQ** *icb.* Qırmancla vurdurmaq, qırmancla döydürmək.

**QIRMA(N)CLI** *sif.* Əlində qırmanc olan. *Arada gəzən əli qırmanclı nəzarətçilər "tənbəllik" edənləri döyəcək(dilər*). M.Rzaquluzadə.

**QIRMASAQQAL** *sif.* Saqqalı üzdən qayçı ilə vurulmuş, üstdən qayçılanmış, üzündə xətt qoymuş. *Məriz, dərviş libasında qırmasaqqal, uzun, cavan bir oğlandır..* Ə.Haqverdiyev.

**QIRMATÜFƏNG** *is.* Beldən qatlanan, bükülən ov tüfəngi.

**QIRMIZ** *is.* 1. B a x **qırmızböcəyi**.

2. Bu böcəkdən hasil edilən qırmızı boya.

**QIRMIZBÖCƏYİ** *is. zool.* Boyayıcı maddə istehsal edilən böcək cinsi.

**QIRMIZI** *sif.* 1. Qan rəngli; al. *Qırmızı boya. Qırmızı şərab. – Gəlin ağlayır; gözlərinin yaşları od kimi tökülüb, qırmızı yanaqlarını dağlayır*. Çəmənzəminli. *..Zəhra xala stol qoyub, üstünə qırmızı örtük salmışdı.* Mir Cəlal. *Günəşli günlərdə yerlərə səpilmiş yaşıl, qırmızı, sarı yarpaqlarla .. döşənmiş kimi görünən meşə indi tutqun, bozumtul bir rəng almışdı.* M.Rzaquluzadə.

2. *məc.* Gözəllik, parlaqlıq, aydınlıq, fərəh doğuran şey mənasında. *Yox olar qar, boran, günəş də doğar; Yetişər qırmızı, sevimli bahar.* A.Şaiq.

3. B a x **qızıl** 3-cü mənada. ◻ **Qırmızı qvardiya** – b a x **qvardiya**. // İs. mənasında, yalnız cəm şəklində: **qırmızılar** *tar.* – inqilabçılar, kommunistlər, inqilabi qoşunlar. *Kremlin, o indi də qırmızılar oynağı; Neronların Roması yanında heçdir belə...* A.İldırım.

4. *məc.* Nəzakətsizlik dərəcəsində açıq; açıq danışan, sözü üzə deyən. *Telli qırmızı* (z.) *danışmağı sevirdi*. Ə.Vəliyev. // Tamamilə açıq, açıq-aydın, kobudcasına. *..Əgər baxıb görsən ki, bu cürə qırmızı yalançılığı zarafata salıb gülürlər, onda bəd olmaz ki, biz də işimizi irəli aparmaq üçün o cürə "hileyi-siyasi"lərə əl ataq*. Ü.Hacıbəyov.

5. Bəzi mürəkkəb terminlərin birinci tərkib hissəsi; məs.: qırmızı turp, qırmızı üskükotu, qırmızı şüalar.

◊ **Qırmızı ağac** – qiymətli mebel və s. üçün istifadə edilən bəzi ağacların, xüsusilə tropik ağacların oduncağı. *Qırmızı ağacdan qayrılmış mebel*. **Qırmızı guşə** – b a x **guşə**. **Qırmızı lövhə** – b a x **lövhə**. **Qırmızı yumurta bayramı** – b a x **qızıl**.

**QIRMIZIBALDIR** *is. məh. bot.* Bulaqların ətrafında bitən qırmızı saplaqlı pencər; yeyilən ot.

**QIRMIZIBİRÇƏK** *sif. köhn.* Birçəkləri hənalı. *Bazarın başında yoğun və qırmızıbirçək bir baqqal.* "*Buy, dəli Səmədə bax!*" *– deyib, ona bir çürük badımcan səlbəsi atdı.* Çəmənzəminli.

**QIRMIZIBOĞAZ** *is. zool.* Boğazının altı qırmızı balaca köçəri quş.

**QIRMIZICA** 1. *sif.* Azca qırmızı, bir az qırmızı.

2. *zərf məc.* Həyasızca, utanmadan; açıq-aydın. *Qırmızıca yalan demək. – Yəqin ki, qeyri yazıçılarımız da mənim kimidirlər və hər kəs desə ki, "xeyr", lap qırmızıca yalan deyir.* C.Məmmədquluzadə.

**QIRMIZIDƏRİLİ** 1. *sif.* Dərisinin rəngi qırmızı olan. *Qırmızıdərili tayfalar*.

2. *is.* Cəm şəklində: **qırmızıdərililər** – Şimali və Cənubi Amerika hindiləri (bədənlərini qırmızı rəngə boyadıqları üçün avropalılar tərəfindən belə adlandırılmışlar).

**QIRMIZIGÖZ** *sif.* 1. Gözləri qızarmış, gözləri qırmızı rəngdə olan. *Qırmızıgöz balıq. Qırmızıgöz dovşan.* // Gözləri qanla dolmuş. 2. *məc. zar. dan.* Qırmızı, al. "*Qırmızıgöz*" *şərabdan içdikcə dəmiryolçuların gözləri qızardı.* "Kirpi".

**QIRMIZIQABIQ** *sif.* Qabığı qırmızı olan. *Qırmızıqabıq nar. Qırmızıqabıq alma.*

**QIRMIZILAŞDIRILMA** "Qırmızılaşdırılmaq"dan *f.is.*

**QIRMIZILAŞDIRILMAQ** *məch.* Qırmızı rəngə boyadılmaq, qırmızı edilmək; allaşdırılmaq.

**QIRMIZILAŞDIRMA** "Qırmızılaşdırmaq"dan *f.is.*

**QIRMIZILAŞDIRMAQ** *f.* Qırmızı rəngə boyamaq, qırmızı etmək; allaşdırmaq.

**QIRMIZILAŞMA** "Qırmızılaşmaq"dan *f.is.*

**QIRMIZILAŞMAQ** *f.* Qırmızı olmaq, qırmızı rəng almaq; allaşmaq.

**QIRMIZILI** *sif.* Qırmızıya çalar, qırmızı qarışığı olan. *Addımbaşı qırmızılı, sarılı, yaşıllı sular yerin qatlarından üzü yuxarı gəzə-gəzə dik qaynayır, çıxır və axıb gedirdi.* S.Rəhimov. // Qırmızı geyinmiş, al geyinmiş. *Bənzəyir tovuz quşuna; Qırmızılı, allı Gülnaz.* Aşıq Vəli.

**QIRMIZILIQ** *is.* 1. Qırmızı rəngdə olan şeyin halı; allıq. *Qanın qırmızılığı. Üzün qırmızılığı.* // Qırmızı rəng, qırmızı ləkə, qızartı. *Boğazında qırmızılıq var. Yara yerinin qırmızılığı getdi.* – [Rzaqulu xanın] *çöhrəsi qayət solğun isə də, yanaqlarında sarıntı ilə qarışıq bir qırmızılıq qalmışdı.* M.S.Ordubadi. [Qadının] *qarabuğdayı üzündə bir dirilik, yanaqlarında .. bir qırmızılıq, gözlərində bir dərinlik mövcud idi.* S.Hüseyn.
2. *məc.* Həyasızlıq, utanmazlıq.

**QIRMIZIMTIL** *sif.* Qırmızı rəngə çalar, qırmızıya çalar. *Qırmızımtıl alma.* – *Ağabəyim saray tərəfə qalxan cığırla huşsuz addımlarla irəliləyir, göyün üzündəki qırmızımtıl bulud parçalarına tamaşa edirdi.* Çəmənzəminli.

**QIRMIZIMTILLIQ** *is.* Qırmızımtıl şeyin halı; qırmızıya çalarlıq.

**QIRMIZIMTRAQ** b a x **qırmızımtıl**. *Əşrəf indi büsbütün dəyişmiş, .. göz qapaqları şişmiş və qırmızımtraq bir rəng almışdı.* A.Şaiq. *Yer üzü qırmızımtraq bir rəngə boyanırdı.* Ə.Əbülhəsən.

**QIRMIZIPEYSƏR** *sif.* Boynunun ardı qırmızı olan (adətən "boynuyoğun", "tüfeyli" mənasında işlənir).

**QIRMIZISAQQAL** *sif.* Saqqalı qızardılmış, saqqalı hənalı. *Qırmızısaqqal qoca.* – *Çadırda turanlı qırmızısaqqal bir qoca oturmuşdu.* A.Bakıxanov. [Zeynal] *lap yuxarı qəfəsədən beş top çiti çiyninə alaraq nazik taxta nərdivanla aşağı düşən qırmızısaqqal bir kişini görüb dedi..* Ə.Əbülhəsən. // *is.* Saqqalına həna qoymuş kişi; dindar, mövhumatçı. *Yazıq şair övrət məsələsini fars və ərəb dilində danışır ki, Ordubad qırmızısaqqalları başa düşməsinlər ki, hay-küy salmasınlar.* C.Məmmədquluzadə.

**QIRMIZISİFƏT** *sif.* Sifətinin rəngi qırmızı olan, sifəti qızarmış. *Teybə .. qırmızısifət, düz qamətli, dolğun əndamlı, ucaboy .. bir qadın idi.* M.Hüseyn. *Bir saat sonra qərargahdan qırmızısifət bir leytenant gəldi.* Mir Cəlal.

**QIRMIZITƏPƏ** *sif.* Təpəsi qırmızı parçadan olan (papaq). *Leylək Ələmdar gödək, büzmə çuxa, uzunboğaz çəkmə geyinmiş, .. qırmızıtəpə .. papağını da başına qoymuşdu.* S.Rəhimov.

**QIRMIZIYANAQ** *sif.* Yanaqları qırmızı olan. *Qırmızıyanaq uşaq.*

**QIRNA** *is.* Kran. *Hamamın qabağına qırnadan su axır.* C.Məmmədquluzadə.

**QIROV**[1] *is.* Payızın axırlarında soyuqlar düşəndə gecələr yerə, yarpaqlar və s. üzərinə kiçik kristallar şəklində qonan qar kütləsi, şehin donmuş zərrələri. *Əgər qışda hava çox soyumuş olsa, şəbnəm dönüb buz olur, yerə düşür ki, ona qırov deyirlər.* H.Zərdabi. *Atım köpüklənir, atım buğlanır; Donmuş qırov kimi sinəsində tər.* S.Vurğun. *Üstünü şeh və qırov basmış körpə otlar günəşin işıqları altında parıldayırdı.* M.İbrahimov.

**QIROV**[2] *is.* İnsan və heyvanın gözündə əmələ gələn cüzi görməməzlik; göz nöqsanı.

**QIROVLAMA** "Qırovlamaq"dan *f.is.*

**QIROVLAMAQ** *f.* Qırov bağlamaq, qırovla örtülmək.

**QIROVLANMA** "Qırovlanmaq"dan *f.is.*

**QIROVLANMAQ** b a x **qırovlamaq**.

**QIRPIQ** *sif.* Kənarları, ucları, başları və s. qırpılmış, kəsilmiş, vurulmuş, qopardılmış. *Başı qırpıq ot.*

**QIRPILMA** "Qırpılmaq"dan *f.is.*

**QIRPILMAQ** 1. *məch.* Kənarları, ucları, başları və s. kəsilmək, vurulmaq, qopardılmaq.

2. *t-siz.* Tez açılıb yumulmaq, açılıb-örtülmək. *Gözləri qırpılmaq. – Bahadırın kirpikləri qırpıldı.* M.Hüseyn.

**QIRPIM** *is.* (adətən "bir", "bircə" sözü ilə). 1. Göz yumub açınca keçən vaxt; an, ləhzə. *Dilbər bir qırpım dayandı.* C.Cabbarlı. *Bircə qırpım sürən şaşqınlıqdan sonra gənc qız .. qəzəblə dilləndi.* M.Rzaquluzadə. ☐ **Bir qırpımda, bir göz qırpımında** – bir anda, göz açıb yumunca, çox tez. *Bir qırpımda divardan aldı ələ qılıncı.* S.Rüstəm. *Bir qırpımda gedirəm min illik bir həyata.* R.Rza. [Ayaz] *bir göz qırpımında atın üstünə sıçrayıb .. gözdən itdi.* Ə.Məmmədxanlı.

2. Heyvanın (qoyunun, inəyin və s.-nin), yaxud qazın bir dəfəyə qırpa biləcəyi qədər az miqdar. *Bir qırpım ot. Bir qırpım yonca.*

**QIRPINMA** "Qırpınmaq"dan *f.is.*

**QIRPINMAQ** *f.* 1. Tez-tez açılıb yumulmaq, açılıb örtülmək. *Onun qonur gözlərini bürümüş uzun kirpikləri tez-tez qırpınırdı.* Ə.Vəliyev. // Məc. mənada. *Günəş qırpınanda açıldı hava; Dayandı ordular, durdu üz-üzə.* S.Vurğun.

2. Utanmaq, çəkilmək, sıxılmaq. *Bu qədər söz deyildi, amma heç qırpınmadı.*

3. Diksinmək, qımıldanmaq, yerindən tərpənmək. *Qoca Alı atın qabaq ayaqlarının üylərini bərk sıxdı, at nə diksindi, nə də qırpındı.* "Koroğlu".

**QIRPITMAQ** *f.* Aşağıya yatırtmaq, yaxud tərpətmək, qımıldatmaq. *Qoyunlar tütəyin səsini eşidən kimi, elə bil ki, bir şeydən ürkdülər; eləcə getdikləri yerdə dayandılar, qulaqlarını qırpıtdılar.* C.Məmmədquluzadə.

**QIRPMA** "Qırpmaq"dan *f.is.*

**QIRPMAQ** *f.* 1. Tez-tez yumub-açmaq, örtüb-açmaq (gözü, kirpiyi). *Musa kişi dərinlərə getmiş, təkcə giləsi işıldayan gözlərini qırpdı.* M.İbrahimov. ☐ **Göz qırpınca** – bir anda, göz yumub açınca. **Göz qırpmamaq** – qorxmamaq, çəkinməmək. *Ən qanlı savaşlarda qorxu bilməyən, ən müdhiş həqiqətlərlə üz-üzə gəldikdə gözünü belə qırpmayan Qazan xan röyadan çox qorxardı.* M.Rzaquluzadə. **Gözlərini (kirpiklərini) qırpmadan (qırpmayaraq) baxmaq** – gözlərini yummadan baxmaq. *Cəlil başını sərt bir hərəkətlə dik qaldırdı, kirpiklərini qırpmadan durğun bir nəzərlə .. baxdı.* M.Hüseyn. // Gözlərini zilləyib baxmaq, gözünü çəkməmək. *Zeynəb də Nadirin kəmetinalığını gördükdə sakit oturub gözlərini qırpmayaraq otağın bucağında asılmış tüfəngin çaxmağına baxırdı.* B.Talıblı.

2. Bir şeyin qıraqlarını, uclarını və s.-ni kəsib atmaq, kəsmək, vurmaq, balaca-balaca qoparmaq. *Lampanın fitilini bir az qırpmaq lazımdır.*

3. Dişləri, ya dimdiyi ilə dartıb qopartmaq. *Qazlar otu qırpırdılar.*

**QIR-SAQQIZ** *is.* 1. Bax **qarasaqqız**.

2. *məc. dan.* Adama yapışaraq əl çəkməyən, adamı təngə gətirən. *O, lap qır-saqqızdır.* ☐ **Qır-saqqız olub yapışmaq** – bərk-bərk yapışaraq əl çəkməmək, təngə gətirmək. *Bir ağızucu söz demək, bir də qır-saqqız olub yapışmaq var.* A.Şaiq.

**QIRT** *is.* Cücə çıxarmaq üçün yumurta üstündə yatan toyuq. ☐ **Qırt basdırmaq** – qırt düşmüş toyuğun altına yumurta qoymaq, cücə çıxarmağa yatırmaq. **Qırt düşmək** – cücə çıxarmaq üçün yumurta üstündə oturmaq ehtiyacında olmaq (toyuq və s. ev quşları haqqında). **Qırt toyuq** – cücə çıxarmaq üçün yumurta üstündə oturmuş toyuq. **Qırt yatmaq** – cücə çıxarmaq üçün yumurta üstündə oturmaq (toyuq və s. ev quşları).

**QIRTIC** *is. bot.* Taxıl fəsiləsindən yem bitkisi.

**QIRTI** *is. dan.* Parça, tikə, azacıq şey.

**QIRTILDAMA** "Qırtıldamaq"dan *f.is.*

**QIRTILDAMAQ** *f.* Qırt-qırt etmək.

**QIRT-QIRT** *təql.* Qırt toyuğun çıxardığı səs.

**QIRTLAQ** *is. anat.* Ağ ciyərlərlə əsnəyi birləşdirən boru; xirtdək. *Son gülləsini atmış həbəş; Dişləri ilə gəmirdi; düşmənin qırtlağını.* R.Rza.

**QIRTLAMA** "Qırtlamaq"dan *f.is.*

**QIRTLAMAQ** *f.* 1. Qırt-qırt etmək. *Toyuq qırtlayır*.

2. Xırda-xırda dişləmək. *Siçan sabahadək nəyi isə qırtlayırdı.*

**QIRTLAŞMAQ** *qarş*. 1. Hamı birdən qırt-qırt eləmək. *Toyuqlar həyətdə qırtlaşırlar*.

2. B a x **qırt düşmək** (“**qırt**”da).

**QIRTLIQ** *is.* Qırt düşmüş toyuğun halı.

**QIRTMAQ** *f. dan.* Azacıq kəsmək, qopartmaq.

**QIRTMIQ** *sif. dan*. Qıraqlarının tükü getmiş. *Başında bir qırtmıq papağı var idi.*

**QIS: qıs vurmaq** – qısqırtmaq; səsləyib, haraylayıb saldırmaq. *Qıs vurun, qoçaqlarım; İti canavara yüyür!* Aşıq Hüseyn.

**QISA** *sif.* 1. Boyca gödək, alçaq; gödək (*uzun* ziddi). *Qısa boy. Qısa ağac. Qısa saç. Qısa paltar*. – [Şəkər] *qısa boz don, göy kofta geymişdi*. Ə.Əbülhəsən.

2. Vaxtı, müddəti az, uzun sürməyən; sürəksiz. *Qısa bir zaman keçdi. Qısa bir sükutdan sonra. Qısa bir görüş. Qısa söhbət. Ən qısa müddətdə. – Öz qısa ömründə təcrübə əldə edən şəxs ondan çox böyük mənfəətə çatır.* A.Bakıxanov. *Heyif ömür qısa, arzu genişdir; Kim bu qayğı ilə titrəməmişdir?* M.Müşfiq.

3. Uzaq olmayan, yaxın. *Qısa yol.*

4. Müxtəsər, təfsilatsız, yığcam. *Qısa məktub. Qısa izahat. Qısa məlumat. Qısa cümlə. Qısa bir teleqram alınmışdır. Qısa* (z.) *cavab vermək. – Nə üçün trest geridə qalır? Sual qısa və aydın olduğu üçün cavab da eyni dərəcədə qısa və aydın olmalı idi.* M.Hüseyn.

◊ **Qısa dalğa** *rad.* – 10 metrdən 150 metrə qədər uzunluqda radio dalğası. *Yerdə gedən döyüşlər qalxıb çıxıb göyə də; Vurur dalğa vuranlar orta, qısa dalğanı*. X.Rza. **Qısa keçmək** – bir məsələnin üstündə çox dayanmamaq, üstündən tez keçmək. **Qısa kəsmək** – uzatmamaq, müxtəsər danışmaq. **Sözün qısası** – xülasə, müxtəsər. *Ey dəli Kür! İşvəli Kür! Artıq topla özünü; Gəl qısa kəs sözünü*. Ə.Cavad.

**QISAAYAQ** *sif.* Ayağı qısa olan. *Qısaayaq miz.*

**QISABOĞAZ(LI)** *sif.* Boğazı, quncu qısa olan, gödək boğazlı. *Qısaboğaz çəkmə. Qısaboğaz corab*.

**QISABOY(LU)** *sif.* Boyu uzun olmayan, gödəkboylu, gödək. – *Kərim baba .. qısaboylu, geniş kökslü bir qoca idi.* A.Şaiq. *Qərənfilin atası Rüstəm kişi qısaboy bir adamdı.* S.Rəhman. *Xanbala 30 yaşlarında, arıq, qısaboylu .. bir kəndli idi*. H.Sarabski.

**QISABOYUN(LU)** *sif.* Boynu qısa olan. *Qısaboyunlu adam*.

**QISABUYNUZ(LU)** *sif.* Buynuzları qısa olan. *Qısabuynuzlu camış*.

**QISACA** *sif.* 1. Az qısa, çox uzun olmayan. *Qısaca boylu kişi.*

2. Müxtəsərcə, gödəkcə; qısa, müxtəsər; ötəri. *Qısaca söhbət. – Mədəd Tapdığa qısaca suallar verməyə başladı.* Ə.Əbülhəsən. // Zərf mənasında. *Qısaca danışmaq. Vəziyyətlə qısaca tanış oldum*.

**QISACIQ** *sif.* 1. Çox qısa, lap qısa. *Qısacıq paltar*.

2. Çox müxtəsər, lap gödək (söz, iş və s.).

**QISADALĞAÇI** *is. rad*. Qısa dalğada radio verib qəbul etməklə məşğul olan radio həvəskarı.

**QISADALĞALI** *sif. rad*. Qısa dalğalarda radio verən və qəbul edən. *Qısadalğalı radioverilişi qurğuları*.

**QISAQIÇ(LI)** *sif.* Qıçları çox qısa olan. *Qısaqıçlı kişi*.

**QISAQOL(LU)** *sif.* Qolu qısa olan, qolu gödək. *Qısaqollu paltar*.

**QISAQUNDAQLI** *sif.* Qundağı qısa. [Səttarxan] *qısaqundaqlı bir Avstriya karabini götürmüşdü*. P.Makulu.

**QISAQUYRUQ(LU)** *sif.* Quyruğu uzun olmayan, gödəkquyruq. *Qısaquyruq xoruz. – Sarxangilin qapısında qısaquyruqlu bir it vardı.* M.Hüseyn.

**QISALDILMA** “Qısaldılmaq”dan *f.is.*

**QISALDILMAQ** *məch.* Gödəldilmək, güdə kəsilmək, kəsilib qısa edilmək. // Müxtəsərləşdirilmək.

**QISALDILMIŞ** *f.sif.* Qısa hala salınmış, gödəldilmiş, azaldılmış, ixtisar edilmiş. *Qısaldılmış palto. Qısaldılmış iş günü.*

**QISALIQ** *is.* Qısa şeyin halı; gödəklik (*uzunluq* ziddi). *Paltarın qısalığı. Söhbətin qısalığı. Cavabın qısalığı. Günlərin qısalığı ildə iki dəfə olur.* // Müxtəsərlik.

**QISALİFLİ** *sif. k.t.* Lifləri, telləri qısa olan. *Qısalifli pambıq*.

**QISALMA** "Qısalmaq"dan *f.is.*

**QISALMAQ** *f.* 1. Gödəlmək, qısa olmaq, yığılmaq. *Köynək yuyulub qısalmışdır. Boyu qısalmaq.*

2. Müddətcə azalmaq, məhdudlaşmaq. *Qışda günlər qısalır.*

**QISALMIŞ** *f.sif.* Qısa hala düşmüş, gödəlmiş, azalmış. *Qısalmış palto.*

**QISALTDIRMA** "Qısaltdırmaq"dan *f.is.*

**QISALTDIRMAQ** *icb.* Gödəldilmək, qısa hala saldırmaq. *Şalvarı dərziyə verib qısaltdırmaq. Saçlarını dəlləyə qısaltdırmaq.*

**QISALTMA** "Qısaltmaq"dan *f.is.*

**QISALTMAQ** *f.* 1. Bir şeyi gödək etmək, qısa etmək, gödəltmək, azaltmaq, ixtisar etmək. *Paltarın ətəklərini qısaltmaq. Paltonun qollarını qısaltmaq.*

2. Müxtəsər etmək, uzatmamaq, tez qurtarmaq. *Söhbəti qısaltmaq. Mübahisəni qısaltmaq. – Hacıyev mətləbi qısaltmaq istədi.* Mir Cəlal.

**QISAMETRAJLI** *sif.* Uzunluqca adi filmlərdən qısa olan. *Qısametrajlı film. –* "*Azərbaycanfilm*" *kinostudiyası bir sıra qısametrajlı filmlər istehsal etmişdir.*

**QISAMÜDDƏTLİ** *sif.* Az müddəti nəzərdə tutan; qısa müddətdə olan, baş verən, az müddət davam edən, çox sürməyən. *Qısamüddətli borc. Qısamüddətli ezamiyyət.*

**QISARAQ** *sif.* Bir qədər qısa, gödək.

**QISASAÇLI** *sif.* Saçları gödək olan, saçları qısa kəsilmiş, gödəksaçlı. *Qısasaçlı qız.*

**QISAYUNLU** *sif. xüs.* Yunu qısa olan. *Qısayunlu qoyunlar.*

**QISDIRMA** "Qısdırmaq"dan *f.is.*

**QISDIRMAQ** *icb.* Qısmağa məcbur etmək, sıxdırmaq.

**QISICI** 1. *sif.* Qısan, sıxan, tutan.

2. *is. xüs.* Sıxıcı (tutucu) alət. *Hidravlik qısıcı.*

**QISIQ** *sif.* 1. Qısılmış, sıxılmış, kiçilmiş; qısaldılmış, qısa. *Ağacların, divarların qısıq kölgələri ərimiş, filiz kimi donmuş dururdu.* A.Şaiq.

2. Boğuq, tutqun, batmış, xırıltılı.

**QISIQLIQ** *is.* 1. Qısılmış (sıxılmış) şeyin halı.

2. Boğuqluq, xırıltı.

**QISILMA** "Qısılmaq"dan *f.is.*

**QISILMAQ** *f.* 1. Bir şeyin arasında qalıb bərk sıxılmaq. *Barmağım qapının arasında qısıldı.* // Ümumiyyətlə, sıxılmaq. *Qocurdan Tiflisi görəndə Bahadırın ürəyi qısıldı..* N.Nərimanov. *Adamın ürəyi elə qısılır ki, deyəsən bəs bir daş qəfəsə düşübdür.* S.Rəhimov.

2. Tutulmaq, xırıldamaq, batmaq (səs).

3. Sığınmaq, daldalanmaq, bir yerə sıxılmaq, büzüşüb qalmaq, gizlənmək. *Səriyyə xanım evin bucağına qısılıb tez-tez kirpik çalır və ağzındakı saqqızını çeynəyirdi.* M.S.Ordubadi. [Məmməd:] *Bəs niyə nənəm o günü Məlik Məmmədin nağılını söyləyəndə .. məmənin qucağına qısıldın?* S.S.Axundov. *Bahadır divara qısılıb, intizardan geniş açılmış gözlərini Pəri nənəyə dikmişdi.* M.Hüseyn.

4. Utanmaq, sıxılmaq, çəkinmək. *Danışarkən qısılmaq. Kamil qısılmasa, yaxşı oxuyar. – Heç qısılma bu məclisdə; Bu məclis ər meydanıdır.* Aşıq Vəli.

**QISILMIŞ** *f.sif.* Sığınmış, daldalanmış, bir yerə sığınmış, gizlənmiş. *Şən qəhqəhə və gurultularımızla .. kollar və budaqlar arasında qısılmış quşları qaçırırdıq.* A.Şaiq.

**QISINMAQ** 1. Bax **qısnamaq**. [Tarverdi:] *Namaz, bura gəl, bilirsənmi, cəbr eləmə; görürsən ki, qorxurlar, dəxi niyə qısınırsan?* M.F.Axundzadə.

2. Bax **qısılmaq** 3-cü mənada. *Balaca uşaqlar yenə də analarına qısınıb yalnız indi tanıdıqları köhnə qonşularına baxır*(*lar*). M.Hüseyn.

**QISINTI** *is.* Sıxıntı, çətinlik. *Qısıntı çəkmək.*

**QISIR** *sif.* Müvəqqəti və ya həmişəlik doğmayan. *Qısır inək.*

**QISIRƏMƏN** *sif.* Qısır qalmış anasını təkrar əmən. *Qısırəmən dana.*

**QISIRLAMA** "Qısırlamaq"dan *f.is.*

**QISIRLAMAQ** *f.* Qısır qalmaq, doğmamaq, bala verməmək.

**QISIRLIQ** *is.* Qısır olma, doğmama, bala verməmə.

**QISQAC** *is.* 1. *zool.* Rütubətli yerlərdə daşların altında yaşayan sarı rəngli, haça quyruqlu uzunsov cücü.

2. *zool.* Başında qayçı kimi sıxıcı buynuzları – müdafiə aləti olan cücü; qayçıkəsən.

3. Xərçəng kimi heyvanların sıxıcı üzvləri.

4. *xüs*. Sıxıcı alət. *Brezent torbada müxtəlif alətlər; çəkic, .. qısqac və s. görünürdü*. Ə.Sadıq.

**QISQACLI** *sif.* Qısqacı olan.

**QISQANAN** *f.sif.* b a x **qısqanc**. *Mənim rəhmətlik ərim də çox qısqanan adamdı*. M.S.Ordubadi.

**QISQANC** *sif.* 1. Çox qısqanan. *Qısqanc ər. Qısqanc qadın. – Bir-birinə rəqib kəsilən və sönük piltənin bozumtraq alovunu qucaqlamaq istəyən qısqanc pərvanələrin son dəstələri qırılır və dəli bir sevgiyə qurban verilirdi.* M.S.Ordubadi.

2. Paxıl, qibtə edən.

3. Xəsis, bir şeyi başqasına əsirgəyən, acgöz. // Məc. mənada. [Qəhrəman] *baharın təravətli qoxusunu qısqanc bir həvəslə qoxulayıb, sinəsi qabarırdı.* Ə.Vəliyev.

**QISQANCLIQ** *is.* 1. Sevdiyi bir adamın tam sədaqət və məhəbbətinə qarşı doğan şübhə, etimadsızlıq hissi; sevdiyi bir adamın başqasına qarşı yaxşı münasibətinə dözməmək xasiyyəti. [Həyat:] *..Sənin qısqanclıqların da, şübhələrin də mənə xoş gəlir.* M.İbrahimov. *Onun duyğuları .. qısqanclıqdan uzaq idi*. İ.Əfəndiyev.

2. Paxıllıq, qibtə. *Həsəd və qısqanclıq xanla xatını qəribə bir təbə salırdı*. S.Rəhimov.

3. Xəsislik, acgözlük, bir şeyi başqasına əsirgəmə.

**QISQANDIRILMAQ** "Qısqanmaq"dan *məch*.

**QISQANDIRMA** "Qısqandırmaq"dan *f.is.*

**QISQANDIRMAQ** *icb.* Birinin qısqanmasına səbəb olmaq, birində qısqanclıq hissi doğurmaq.

**QISQANIŞ** *is.* Qısqanma. *Qadın və qızlarda .. qısqanışlar həddindən artıqdır*. M.S.Ordubadi.

**QISQANMA** "Qısqanmaq"dan *f.is.*

**QISQANMAQ** *f.* 1. Sevdiyi, qəlbində məhəbbət bəslədiyi bir adama başqasının münasibətini çəkə bilməmək, yaxud yaxın bir adamının başqasına daha çox meyil və məhəbbət göstərdiyinə, daha çox sədaqətli olmasına şübhələnərək ruhi əzab çəkmək. *Hüsaməddin qaşqabağını turşutmuşdu; o, Qətibə ilə Toğrulun əlaqəsindən şübhələnir və qısqanırdı.* M.S.Ordubadi. *Orda bütün gözlər səni süzərkən; Qısqanmağa başlayıram mən həmən.* H.Cavid. // Şübhələnmək, çəkinmək, ehtiyat etmək. *Dayı, məndən qısqanma, mən çörəyi dizi üstündə olan nəməkbəhəram adamlardan deyiləm.* A.Divanbəyoğlu. // b a x **qısqınmaq**. [Əziz bəy:] *Yeri gələndə o özü də danışmaqdan çəkinən və qısqanan deyil!* M.F.Axundzadə.

2. Qibtə etmək, həsəd aparmaq, paxıllıq etmək. *Uşaq kiçik qardaşını qısqanır*.

3. Xəsislik etmək, əsirgəmək, acgözlük etmək.

**QISQI** *is.* 1. Tələsdirmə, qısnama, qısnağa salma. ☐ **Qısqı basmaq (gəlmək)** – b a x **qısqılamaq**.

2. Hədə, qara-qorxu; hədələmə, sıxışdırma. *Qısqı güclü olanda, qorxaq bacadan qaçar*. (Ata. sözü). *Səlim bəy Nəbinin qısqısından sonra, utandığından bir həftə çölə çıxmayıb bu əhvalatı gizlin saxlamağa çalışdı*. "Qaçaq Nəbi". ☐ **Qısqıya basmaq** – hədələmək, təhdid etmək, qorxutmaq, sıxışdırmaq.

**QISQILAMAQ** *f. dan.* Sıxışdırmaq, qısnamaq.

**QISQIN** *dan.* b a x **qısqı** 1-ci mənada.

**QISQINMAQ** *f. dan.* Çəkinmək, utanmaq, sıxılmaq.

**QISQINTI** *is. dan.* Sıxışdırma, tələsdirmə, qısnama. // Sıxıntı, əziyyət.

**QISQIRDILMA** "Qısqırdılmaq"dan *f.is.*

**QISQIRDILMAQ** *məch.* Üzərinə saldırılmaq (it).

**QISQIR(T)MA** "Qısqır(t)maq"dan *f.is.*

**QISQIR(T)MAQ** *f.* İti birinin üzərinə saldırmaq qəsdi ilə qıs-qıs demək. [Ovçular] *mağaranın içindən ayının nəriltisini eşidib, tüfənglərini hazırladılar və itləri içəri qısqırtdılar.* S.S.Axundov. *..Ağsaqqal və mömin adamlar köpəkləri, itləri buraxıb, qısqırda-qısqırda* (z.) *xortdanın üstə hücum etdilər.* B.Talıblı. // *məc.* Bir adamı digərinin üzərinə saldırmaq, vuruşmağa təhrik etmək. *Rus Əhmədlə gəzən adam onlara əcaib təsir bağışlayırdı. Hətta dəcəllik edib onlara it qısqırdanlar da olurdu.* İ.Şıxlı.

**QIS-QIS** İti qısqırtmaq üçün işlənən nida.

**QIS-QIVRAQ** b a x **qıvraq**. [Nəriman] *belini enli qayışla qıs-qıvraq bağlamışdı.*

İ.Əfəndiyev. *Fəvvarə vuraraq qaynayır bulaq; Hovuz zireh geyir sudan qıs-qıvraq.* Şəhriyar.

**QISMA** “Qısmaq”dan *f.is.*

**QISMA-BOĞMA** *is.* Hər tərəfdən sıxışdırma, qısnama. □ **Qısma-boğmaya salmaq** – çox sıxışdırmaq, çox qısnamaq. [Aqronom:] *Nə başlayıblar məni qısma-boğmaya salmağa?..* M.Hüseyn. *Qələndərlə bir neçə nəfər isə öz sualları ilə Zülfüqar kişini qısma-boğmaya salmışdılar.* Ə.Əbülhəsən.

**QISMAQ** *f.* 1. Sıxıb tutmaq, iki şey arasında bərk sıxmaq. [Şərəfnisə xanım] *şəkil kağızlarını dişin-dişinə qısıb, əlində bərk-bərk övkələyir, salır ayağı altına.* M.F.Axundzadə. [Kərim baba] *uşaqlara məxsus bir sevinclə sümsünü iri dodaqları arasına qısıb çalmağa başladı.* A.Şaiq.

2. Yatırmaq, kip yapışdırıb sıxmaq, basmaq. *Adətdir, quyruğun buduna qısar; Hər yerdə ki görsə köpəyi paraq.* Q.Zakir. *Qurd .. quyruğunu böyrünə qısaraq, dili ilə pələngi yalayırdı.* A.Şaiq.

3. Ümumiyyətlə sıxmaq. *..Bir gün mədaxil çox olar, bir gün az olar, nə lazım ürək qısmaq.* Ə.Haqverdiyev. [Şamamanın anası:] *A kişi, sən allah, o qara günləri yadımıza salıb ürəyimizi qısma..* İ.Əfəndiyev.

4. Gizlətmək, çəkmək. *Toyuqlar boyunlarını içəri qısaraq, gözlərini qırpırdılar.* H.Nəzərli. *Onun hər bir kəlməsini yaxşı eşitmək üçün hamı nəfəsini qısıb dinlədi.* M.Hüseyn.

5. Qənaət etmək, azaltmaq, daraltmaq, kiçiltmək, kəsmək, sıxışdırmaq. *Xərci bir qədər qısmalı. Yüz manat qısıb saxlamışam.*

**QISNAQ** 1. *is.* Çox çətin girilə bilən yer.

2. *sif.* Tələsik, təcili, təxiredilməz. *Qısnaq iş.* □ **Qısnağa salmaq** – tələsdirmək, sıxışdırmaq.

**QISNAMA** “Qısnamaq”dan *f.is.*

**QISNAMAQ** *f.* Təkidlə israr etmək, təkidlə tələb etmək; bərk qısqı gəlmək; sıxışdırmaq, dirənmək. [2-ci kəndli:] *Bizi niyə belə dara qısnayırsan?* Ə.Haqverdiyev. *Mənim qardaşım gəlib məni qısnayıbdır ki, tez ol, məni də məktəbə qoy.* C.Məmmədquluzadə. *Kəndlilər .. Nəbini gizlətdilər. Naçalnik nə qədər qısnadısa, boyun olmadılar.* “Qaçaq Nəbi”.

**QISRAQ** *sif.* Doğmayan, qısır. *O, qısraq şeydir, öküz deyil ki, qulaqlayıb cütə qoşasan.* S.Rəhimov.

**QIŞ** *is.* İlin payızdan sonra gələn ən soyuq fəsli. *Qarlı qış günündə. Bu il qış çox gec gəldi. – Doğrudur, kəndlərdə və balaca şəhərlərdə qışın o qədər bir səfası yoxdur, amma Tiflis kimi yerdə qış böyük bir qənimətdir.* C.Məmmədquluzadə. *O, şaxta, boranlı qış da bitdi; Alqışladığım bahar yetdi.* A.Şaiq. *Qərib qış axşamları yollara qar yağanda; At sürüb bir şenliyə, gecələdim Muğanda.* Ə.Cəmil. □ **Qış-yay (yaz)** – daima, həmişə, ilin bütün fəsillərində. *Qış-yay bu cür paltar geyir. – Dörd yolun kəsişdiyi və bütün küçələrin birləşdiyi bu bağda həmişə qış-yay adam olurdu.* İ.Şıxlı.

**QIŞÇİÇƏYİ** *is. məh. bot.* Aran rayonlarda bitən tez çiçəklənən ot bitkisi.

**QIŞQIR-BAĞIR** *is.* Qışqırıq, çığır-bağır, qışqırma. *Qışqır-bağır salmaq. – Zeynal əvvəl bu qışqır-bağırla* (z.) *bu özbaşınalığın qabağını almaq istəyirdi.* Ə.Əbülhəsən.

**QIŞQIRIQ** *is.* Çığırtı, bağırtı, çığırtı səsi. *Qışqırıq qopmaq. Qışqırıq salmaq. Onun qışqırığını uzaqdan eşitdim. – Bu qədər qışqırığa durdu qonum-qonşu təmam; Dəbərişməz də, veribdir, deyəsən, can, ölübə!* M.Ə.Sabir. [Şəmsi bəy:] *..Bu iki xanımdan bir qışqırıq qalxdı ki, dedim, yəqin qarşılarına aslan çıxmışdır.* S.S.Axundov.

**QIŞQIRIQ-BAĞIRIQ** b a x **qışqır-bağır**. *Molla yenə də qışqırıq-bağırıqla* (z.) *məsələnin üstünü birtəhər örtmək istədisə də, bu dəfə Sirat ona imkan verməyərək belə bir məsəl də çəkdi..* Ə.Əbülhəsən.

**QIŞQIRIQÇI** *sif.* Daima qışqıran, bağıran, küy-kələkçi, çığırqan. *Qışqırıqçı uşaq.*

**QIŞQIRIŞMA** “Qışqırışmaq”dan *f.is.*

**QIŞQIRIŞMAQ** *qarş.* Hamı birdən, hərə öz yerindən qışqırmaq. *Biz bir ağızdan qışqırışdıq.* S.Rəhimov. *Qızlar gülüşərək yer-bəyerdən qışqırışdılar.* Ə.Məmmədxanlı.

**QIŞQIRMA** “Qışqırmaq”dan *f.is.*

**QIŞQIRMAQ** *f.* Bərkdən çığırmaq, bağırmaq. *Cənnət xanım .. başını silkələyib elə qışqırdı ki, üzündən pudraələndi.* Mir Cəlal.

**QIŞQIRTI** *is.* Qışqırıq, çığırtı, bağırtı; qışqırıq səsi. *Balaca uşaqlar .. biqeyd bağın*

*xiyabanlarında qışqırtı ilə yüyürüşürlər.* Ə.Haqverdiyev. *Elə bu zaman səbir kasası aşıb-daşan Zərrintac xanımın qışqırtısı bütün həyəti götürdü.* S.Rəhimov. *Bayaqkı qışqırtı və bağırtıdan hürkmüş .. müdir nəfəs aldı.* M.İbrahimov. // *məc.* Səs, gurultu, şarıltı, şırıltı. *Çayın qışqırtısı qaranlığın qatı sükutunu pozur, çay səllimi at kimi baş alıb gedir.* Ə.Vəliyev.

**QIŞQIRTMA** "Qışqırtmaq"dan *f.is.*

**QIŞQIRTMAQ** *icb.* Birinin qışqırmasına, bağırmasına, çığırmasına səbəb olmaq; bağırtmaq.

**QIŞLA** *is.* 1. Əsgəri hissələri yerləşdirmək üçün böyük bina; qazarma. *Şəhərə buraxılan qoşun dəstələri bu gün öz qışlalarına çəkilmişdi.* M.S.Ordubadi. *Bu, qışladan bir neçə yüz metr qədər dalda olan bacanın suyu idi.* Ə.Əbülhəsən.

2. Fabriklər yanında fəhlələr üçün ümumi yaşayış evi. *Araz yoldaşlarını görmək məqsədi ilə evdən çıxıb, fəhlə qışlasına getmək istəyirdi.* A.Şaiq. *Buyurun, baxın, görək bunlar təzə şəhər evlərinə oxşayır, yoxsa adi bir qışlaya.* Mir Cəlal.

**QIŞLAQ** *is.* Qoyun və başqa ev heyvanlarının gətirilib saxlandığı mötədil havalı və otlaqlı qışlama yeri. *Heyvanlar yaylaqdan qışlağa köçdü.* // Qışı keçirmək üçün bina və s. olan yer; oba, kənd. *Əvvəlinci məclis Qarabağ vilayətində .. yazın əvvəlində Novruz bayramından bir gün keçmiş Təklə-Muğanlının qışlağında vaqe olur.* M.F.Axundzadə. *Küləkli qar, yağış yağar uzun-uzadı yaylağa; Köçər o vaxt el-oba, enər tamami qışlağa.* A.Səhhət. *Qışlaqda idik, payızın aydınlıq gecəsi idi.* A.Şaiq. // *məc.* Yurd mənasında. *Bir vətən eşqilə Mildə, Muğanda; Min bir oba qurub, qışlaq saldınız.* S.Vurğun.

**QIŞLAMA** "Qışlamaq"dan *f.is.*

**QIŞLAMAQ** *f.* Qışı bir yerdə keçirmək. *Qoyunlar aranda qışladı. – Qaçarlar isti yerlərə tamam quşlar ol zaman; Bizimlə qışlayar fəqət dolaşa, sərçə, sağsağan.* A.Səhhət. [Pinəçi Qafar:] *Bu qışı burada qışlamasam, mədarım keçməz.* S.S.Axundov.

**QIŞLIQ** *sif.* Qışa, qış fəslinə məxsus, qış üçün ayrılmış, yaxud bir qışa çatacaq qədər olan. *Qışlıq azuqə. Qışlıq odun. Qışlıq paltar.*

**QIŞOTU** *is. bot.* Qışlaqlarda, şoranlıqlarda bitən birillik yem bitkisi.

**QIT** *sif.* Tapılmayan, qəhət, yox dərəcəsində az. *Sərv ağacı hər ağacdan ucadır; Əsli qıtdır, budağında bar olmaz.* Xəstə Qasım. ☐ **Qıt olmaq** – tapılmamaq, tapılmayacaq dərəcədə az olmaq, qıtlaşmaq.

**QITIQOTU** *is. bot.* Tərkibində efir yağı olan iriköklü bitki. // Bu bitkinin xörəyə qatılıb yeyilən kökü.

**QITLAŞDIRMA** "Qıtlaşdırmaq"dan *f.is.*

**QITLAŞDIRMAQ** *f.* Tapılmayacaq bir hala gətirmək, bir şeyin tapılmamasına, son dərəcə azalmasına, qəhətliyə səbəb olmaq.

**QITLAŞMA** "Qıtlaşmaq"dan *f.is.*

**QITLAŞMAQ** *f.* Tapılmaz hala gəlmək, yox olmaq, çatışmamaq, qəhətləşmək, tapılmayacaq dərəcədə azalmaq.

**QITLIQ** b a x **qəhətlik**. *..Qəzvinin ətrafında suyun qıtlığı cəhəti ilə əksəri-məhsulat yanıb əmələ gəlməmişdi.* M.F.Axundzadə. *Bunlar çox zaman qapı qabağında görünürlər, .. qıtlıqdan, zülmdən, zalımdan söhbət edirlər.* S.Rəhimov. *1914-cü il idi. Yavaş-yavaş adada qıtlıq hiss olunurdu.* Ə.Məmmədxanlı.

**QIVIRCIQ** *sif.* Qıvrım halda olan. *Qıvırcıq saç. Quzunun gör nə qıvırcıq dərisi var! – ..Bir qismi də qara gözlərə, qara qıvırcıq saçlara .. daha ziyada məftuniyyət göstərir.* A.Şaiq. *Gündüz o küçələrdə, gur saçları qıvırcıq; Ac zənci balaları dilənir dəstə-dəstə.* Ə.Cəmil.

**QIVIRCIQLANMA** "Qıvırcıqlanmaq"dan *f.is.*

**QIVIRCIQLANMAQ** *f.* Qıvırcıq hala gəlmək, qıvrım-qıvrım olmaq, buruq-buruq olmaq.

**QIVIRCIQSAÇ(LI)** b a x **qıvrımsaç(lı)**. *Söylə görək, Beyrək adlı, boylu-buxunlu, qara, qıvırcıqsaçlı .. bir igid görmədinmi?* M.Rzaquluzadə.

**QIVIRCIQTEL(Lİ)** b a x **qıvrımsaç(lı)**.

**QIVIRCIQTÜKLÜ** *sif.* Tükləri qıvrım-qıvrım olan. [O] *qıvırcıqtüklü papağını boynunun ardına sarı itələyib, ucları kəsik qara kəkilini alnından gözünün üstünə tökmüşdü.* M.Hüseyn.

**QIVRAQ** *sif.* 1. Sağlam, möhkəm, gümrah, səhhətcə yaxşı. *Qıvraq bədən. Xəstə bu*

*gün bir az qıvraqdır. – Səksən yaşındadır, hamıdan qıvraq.* Q.Zakir. *Həkim yaşlı, lakin qıvraq bir adamdı.* Ə.Əbülhəsən. // Çevik, cəld, diribaş, zirək, yüngül. [Qəhrəman yüzbaşı:] *Ədə, cəld tərpəşin!.. Əziz, atı döy, sənin atın qıvraqdır..* C.Məmmədquluzadə. *Adamlar aralanıb Tükəzbana yol verdilər. Tükəzban qıvraq* (z.) *atdan düşüb, şuraya daxil oldu.* B.Talıblı.

2. Yüngül, kip, bədənə yapışan, hərəkətə mane olmayan (paltar, ayaqqabı və s. haqqında). *Qıvraq paltar. Ovçular qıvraq* (z.) *geyinib yola düşdülər. – ..Qaçaqlar gəlirlər, amma qabaqlarınca bir ucaboylu, qıvraq* (z.) *geyinmiş yaraqlı, əsbablı oğlan gəlir ki, çox heybətlidir.* M.F.Axundzadə. [Zaman] *əlindəki dəsmalında sovqatı, ayağında qıvraq çarığı şəhərin yavıqlığındakı kəndə nişanlıbazlığa gedirdi.* Çəmənzəminli.

**QIVRAQLANMA** "Qıvraqlanmaq"dan *f.is.*

**QIVRAQLANMAQ** b a x **qıvraqlaşmaq**.

**QIVRAQLAŞMA** "Qıvraqlaşmaq"dan *f.is.*

**QIVRAQLAŞMAQ** *f.* 1. Sağlamlaşmaq, yaxşılaşmaq, sağalmaq, gümrahlaşmaq. *İstirahətdən sonra xeyli qıvraqlaşıbdır.*

2. Yüngülləşmək.

3. Geyinmək, üst-başını səliqəyə salmaq, düzəltmək. [Xeyransa:] *Hə... hə... hə... yaxşı deyirsən. Bir az dayan, qıvraqlanıb gedək.* H.Sarabski.

**QIVRAQLIQ** *is.* Qıvraq adamın halı; sağlamlıq, yüngüllük, çeviklik.

**QIVRANMA** "Qıvranmaq"dan *f.is.*

**QIVRANMAQ** b a x **qıvrılmaq** 3-cü mənada. [Qəhrəman] *ümidsiz-ümidsiz qıvranır və yerində yatırdı.* S.Rəhimov.

**QIVRIQ** *sif.* Qıvrılmış, qıvrılmış halda olan, qıvrım, buruq-buruq. *Qıvrıq saç.*

**QIVRILIŞ** *is.* Qıvrılma, qıvrılma tərzi.

**QIVRILMA** "Qıvrılmaq"dan *f.is.*

**QIVRILMAQ** *f.* 1. Qıvrıq hala gəlmək, qıvrıq şəkil almaq; burulmaq, buruq-buruq olmaq. *Saçları qıvrılmaq. – Onun .. bir tutumluq ağ saqqalı ətsiz çənəsi üzərindən boğazına doğru qıvrılaraq uzanmışdı.* A.Şaiq. [Tutubəyimin] *iri hörüyü ilan kimi ağ yastığın üstündə qıvrıldı.* Çəmənzəminli. // Təşbehlərdə. *Hər zaman kim, həlqeyi-zülfi-kəcin yad eylərəm; Qıvrılıb əfi kimi yüz ahü fəryad eylərəm.* S.Ə.Şirvani.

2. Halqa şəklində burulmaq, bükülmək, büzüşmək, yaxud bir tərəfdən o biri tərəfə əyilmək. *İlan qıvrılıb yatmışdı. – Hüseynqulu ağa dal tərəfində qıvrılıb yatmış pişiyi ona göstərdi.* S.S.Axundov.

3. Qatlanmaq, bükülmək, bürüşmək, büzüşmək. *Soyuqdan yarpaqlar qıvrılmışdır.*

4. Ağrıdan, sancıdan, hirsdən və s.-dən əyilib bükülmək, yığılmaq, büzüşmək (bədən haqqında). *Xəstə dəhşətli ağrıdan qıvrılırdı. – İki cəngavər, ilan vurmuş kimi, yerində qıvrılan yasavulbaşını .. sicimlə çinarın gövdəsinə sarıdılar.* M.Rzaquluzadə. // *məc.* Əziyyət çəkmək, əzab çəkmək, iztirab çəkmək. *Fəxrəddin bu qədər əzici fikirlərin təsirindən qıvrıldığı zaman, oxuyan qız da .. qəzəlləri oxumağa başladı.* M.S.Ordubadi.

5. Düz olmayan, əyri-üyrü, dalğavari şəkildə uzanıb gedən şey haqqında. *Qəhrəman .. şəhərə girən yolun ağzına çıxır, uzaqdan qıvrılıb gələn yola tamaşa edirdi.* S.Rəhimov. *Ayağımız altında ilan-ilan qıvrılan çaylar var.* M.Müşfiq.

**QIVRILMIŞ** *f.sif.* Qıvrım; qıvrım hala düşmüş. *Kişinin üz-gözünü qıvrılmış qara tük basmış, yanaqlarını və alnını sarı bir ləkə tutmuşdu.* S.Rəhimov.

**QIVRILTMA** "Qıvrıltmaq"dan *f.is.*

**QIVRILTMAQ** *f.* Qıvrıq hala gətirmək, qıvrılmış hala salmaq.

**QIVRIM** 1. *sif.* b a x **qıvrıq**. *Qıvrım o saçın müşkə qalib gəlib aləmdə.* Heyran xanım. *Qıvrım başın əyilmişdir; Doluxsunmuş qara gözün.* R.Rza. *Qızın qıvrım saçları yastığa dağılmışdı.* M.Hüseyn. // Spiral şəklində olan; buruq, burma.

2. *is.* Bir şeyin əyilib bükülən yeri, qıvrım yeri.

**qıvrım-qıvrım** *sif.* və *zərf* Çox qıvrım. *Qıvrım-qıvrım saç. Qıvrım-qıvrım olmaq.*

**QIVRIMLAŞDIRILMA** "Qıvrımlaşdırılmaq"dan *f.is.*

**QIVRIMLAŞDIRILMAQ** *məch.* Qıvrım-qıvrım edilmək, qıvrım hala salınmaq; buruq-buruq edilmək.

**QIVRIMLAŞDIRMA** "Qıvrımlaşdırmaq"-dan *f.is.*

**QIVRIMLAŞDIRMAQ** *f.* Qıvrım-qıvrım etmək, qıvrım hala salmaq, buruq-buruq etmək.

**QIVRIMLAŞMA** "Qıvrımlaşmaq"dan *f.is.*

**QIVRIMLAŞMAQ** *f.* Qıvrım-qıvrım olmaq, qıvırcıq hala düşmək, buruq-buruq olmaq.

**QIVRIMLI** *sif.* Qıvrımları olan, qıvrım. // Əyri-üyrü, buruq-buruq. *..Bu qıvrımlı yollar, yerli dildə desək, qıvraq kəndlilərin ayağına dolaşır.* Mir Cəlal.

**QIVRIMLIQ** *is.* Qıvrım şeyin halı. *Qoyunların yemi kifayət qədər olmayanda, yunun uzanması ləngiyir və keyfiyyəti də pisləşir; möhkəmliyi, uzunluğu, nazikliyi və qıvrımlığı pisləşir.* "Zootexniya".

**QIVRIMSAÇ(LI)** *sif.* Saçları qıvrım olan, buruqsaçlı. *Qaragöz, qıvrımsaç qız güzgünü Nərimandan almadı.* Mir Cəlal.

**QIVRIMSAQQAL** *sif.* Saqqalının tükləri qıvrım (qıvırcıq) olan.

**QIVRINTI** *is.* Bir şeyin qıvrılmış, burulmuş yeri, bükük yeri, qıvrıq yeri.

**QIVRIŞMAQ** b a x **qıvrılmaq**.

**QIY**[1] *is.* Səs, qışqırtı, bağırtı, haray. *Bir az yaxşı dinlə, hey qıya bir bax; Dördnala gəlirlər, atlar çaparaq.* Ə.Cavad. ☐ **Qıy vurmaq, qıy qoparmaq, qıy çəkmək** – qışqırmaq, bağırmaq, səsləmək, nərə çəkmək. *Durnalar düzüləndə; Qıy vurub süzüləndə; Düşmən murada yetər; Əl əldən üzüləndə.* (Bayatı). *Səssiz keçən günlərimlə vidalaşaraq; Haray çəkib, qıy qoparıb çöllər dolanır.* S.Vurğun. [Qaraca çoban] *bağıryaran bir səslə qıy vurub irəli şığıdı. İki qardaşı da gəlib ona qoşuldular.* M.Rzaquluzadə.

◊ **Qıya baxmaq** – qıyğacı baxmaq. *Qəsdin aşıq canın almaqdı əgər; Göz ucilə qıya baxmağın yetər.* Q.Zakir. *Bir şux qıya baxdı, huş aldı sərdən; O cadu gözlərdə, bir əməl gördüm.* Aşıq Dilqəm. *Qıya baxdın, məni saldın firqətə; Səni görsəm dərdim azalı, Gülü!* Aşıq Ələsgər.

**QIY**[2] *is. məh.* Yundan, ipdən, iplikdən toxunma yumru, ya yastı qaytan. *Güləbətin qıydır, yoxsa yengi ay; Öpər, qucar gül yanağın üstündən.* M.P.Vaqif. *Güləbətin qıyı tər sinən üstə; Nə gözəl yaraşır, qız, köynəyinə.* Aşıq Ələsgər.

**QIY**[3] *is.* Gözün ucu, dar tərəfi.

**QIYAQOTU** *is. bot.* Taxılların arasında bitən alaq otu.

**QIYĞACI** b a x **qıyqac** 1-ci mənada. ☐ **Qıyğacı baxmaq** – 1) gözünün ucu ilə baxmaq. *Dilara Həsənə qıyğacı baxıb gülümsədi.* M.İbrahimov; 2) süzgün baxmaq. *Xumar qara gözlərini leylacı; Süzür hərdən, dönüb baxır qıyğacı.* A.Səhhət. *Kiçikxanım qıyğacı baxıb, onun zarafatına gülümsədi.* Mir Cəlal.

**QIYĞACLAMA** "Qıyğaclamaq"dan *f.is.*

**QIYĞACLAMAQ** *f.* Bir şeyi (kağızı, parçanı və s.-ni) qıyğacı bükmək və ya qıyğacı kəsmək. *Çarqatı qıyğaclayıb başına atdı.*

**QIYĞACLANMA** "Qıyğaclanmaq"dan *f.is.*

**QIYĞACLANMAQ** *məch.* Qıyğacı bükülmək, ya kəsilmək.

**QIYIQ**[1] *is.* Torba, çuval və s. tikməyə məxsus iri iynə; çuvalduz. *..Əlinə bir dəmir sünbə, bir də bir qıyıq keçirib, düşüb bu dərənin canına, adını da qoyub palanduz.* S.Rəhimov. *Qıyıqlar xarallara sancıldı.* Ə.Vəliyev.

**QIYIQ**[2] *sif.* Gözlərinin ucu dar, qıyılmış. *Musa kişi qıyıq gözlərini Firidunun fikirli simasından çəkib, uşaqların dalınca baxdı.* M.İbrahimov. *..Elə bil bütün bunlar da tatarın qıyıq gözlərindən gizli qalmırdı.* Ə.Əbülhəsən.

**QIYIQDAN** *is.* Qıyıq qabı, iynə qabı.

**QIYIQGÖZ(LÜ)** *sif.* Gözləri qıyıq olan. *Qıyıqgöz uşaq. – Dəyənin qalın palaz pərdəsi aralandı, qıyıqgözlü, seyrək, uzunbığlı bir yasavul başını içəri uzatdı.* M.Rzaquluzadə.

**QIYILDAMA** "Qıyıldamaq"dan *f.is.*

**QIYILDAMAQ** *f.* Qıy vurmaq (b a x **qıy**[1]).

**QIYILMA** "Qıyılmaq"dan *f.is.*

**QIYILMAQ** *f.* Yığılmaq, yarı yumulmaq. *Təbəssümdən onun gözləri qıyıldı.* Ə.Əbülhəsən. *Molla Qurbanəlinin xırda gözləri qıyıldı.* P.Makulu.

**QIYILTI**[1] *is.* Qıy səsi, qışqırtı. [Qırğıda] *isə gözə çarpacaq qədər bir küskünlük vardı. Onun qıyıltıları, qanad çırpıntıları müəyyən dərəcədə əskilmişdi.* H.Nəzərli.

**QIYILTI**[2] *is.* Gözün qıyılması.

**QIYIŞ** *is.* Gözü qıyma işi və tərzi.

**QIYIŞMAQ** b a x **yığılmaq**.

**QIYQAC** 1. *sif.* Əyri, çəp, yanakı, çəpəki. *Siyah zülfü dal gərdəndə bir qulac; Sona cıqqası tək ucları qıyqac.* Q.Zakir. *Dağ başından günəş baxınca qıyqac; Quşlar durmaz,*

*sərsəm kimi bağırar*. A.Şaiq. *Tikanlı tel uzanır hər yana əyri, qıyqac.* R.Rza.

2. *is.* Çəpinə kəsilmiş, yaxud çəpinə qatlanmış parça və s.; üçkünc baş örtüyü. *Başına güllü qıyqac bağlamış Həqiqət .. torpaq daşıyan, yer qazan, daş aşıran yoldaşlarına baxırdı.* Ə.Vəliyev.

**QIY-QIY** *is.* 1. Bir ayağı üstündə yerimə.
2. Bu cür oynanılan uşaq oyunu.

**QIYLAMAQ**[1] *f.* Qıy vurmaq, qışqırmaq, haray çəkmək, bağırmaq, səsləmək, qışqırıb çağırmaq (bax **qıy**[1]).

**QIYLAMAQ**[2] *f. məh.* Qıy (qaytan) keçirmək, qıya tutmaq (bax **qıy**[2]).

**QIYLI** *sif. məh.* Qıyı olan (bax **qıy**[2]). *Ağzı qıylı heybə.*

**QIYMA** "Qıymaq[1]"dan *f.is.*

**QIYMAQ**[1] *f.* Heyfi gəlməmək, əsirgəməmək; bir şeyi başqasına rəva görmək. *Könül rəva görməz səni yad görə; Səni özgəsinə qıyan deyiləm.* M.P.Vaqif. [Tükəz:] *Sənin evində zəhirmar da tapılmaz; olsaydı onu da qıyıb bizə verməzdin.* M.F.Axundzadə. [Sadıq:] *Ay zalım oğlu, adam da İskəndər kimi oğlana qıyıb güllə atarmı?* Ə.Haqverdiyev.

**QIYMAQ**[2]: **gözlərini qıymaq** – gözlərini yarım yumaraq və kirpiklərini qısaraq baxmaq. *Kərim baba iri, sallaq dodaqlarını geniş-geniş açaraq gözlərini daha da qıydı.* A.Şaiq. *Hesabdar gözlərini qıyıb, üfüqdə iki boy qalxmış günəşə baxdı*. M.İbrahimov.

**QIYMAMA** "Qıymamaq"dan *f.is.*

**QIYMAMAQ** *f.* Heyfi gəlmək, əsirgəmək, bir şeyi başqasına rəva görməmək. *İstər başına durub dolansın; Qıymaz uşaq uyqudan oyansın.* A.Səhhət. [Cənnətəli:] *Sən öləsən, Mirzə, tulalarımın içində elələri var ki, birini bir ata qıymırsan.* N.Vəzirov. [Mürsəl:] ..[Anam] *yumurta bişirmək üçün aldığım təzə tayqulpa qıymır..* Mir Cəlal.

**QIYNAQ** *is.* Yırtıcı quş çəngəli; caynaq. *Çünki onun* [insanın] *pələng kimi dişləri və qıynaqları yox ki, düşmənə qalib olsun, at və maral kimi ayaqları yox ki, qaçıb qurtarsın..* H.Zərdabi. [Bədəl:] *Bizim birinci qəsdimiz .. öz kasıb qardaşlarımızı Pərviz xan və Rəhim xan kimi qaniçənlərin qıynaqlarından qurtarmaqdır*. Ə.Haqverdiyev.

**QIYNA QLAMA** "Qıynaqlamaq"dan *f.is.*

**QIYNAQLAMAQ** *f.* Qıynaqları ilə tutmaq, qıynağına keçirtmək; caynaqlamaq. *Çalağan göyərçini qıynaqlayıb apardı.*

**QIYNAQLANMA** "Qıynaqlanmaq"dan *f.is.*

**QIYNAQLANMAQ** *məch.* Qıynaqla tutulmaq, qıynağa keçirilmək, caynaqlanmaq.

**QIZ** *is.* 1. Qadın cinsindən olan uşaq, övlad. *Yusifin Səlimədən başqa bir oğlu və iki qızı var idi.* N.Nərimanov. *Gəlinlər, qızlar ağır-ağır enib qalxırdılar.* Çəmənzəminli.

2. Hədd-büluğa çatmış, lakin hələ ərə getməmiş qadın cinsli cavan. *Qızlar, oğlanlar yanaşı oturmuşdular.* M.Hüseyn. [Bəşir:] *Ana, .. mənə nə bəy və nə də dövlətli tacir qızı lazım deyil, arayıb bir kasıb qızı taparsan.* S.S.Axundov. [Buğacın anası] *atını məhmizləyib qırx qızla birgə çölə, ovlağa sarı üz qoydu.* M.Rzaquluzadə. // Bakirə mənasında. ☐ **Qız almaq** – evlənmək, evləndirmək. **Qız kimi** – tərbiyəli, utancaq, məsum, ismətli. *Gizli bir eşq var bənzər dənizə; Qız kimi qısılıb ana Təbrizə; Odur ki, çıxmayıb üzə Şahgölü.* S.Tahir. **Qız köçürmək** – qız ərə vermək. *Qadınlar toplanıb oynayır, çalır; Qızı köçürməyə az zaman qalır.* M.S.Ordubadi. **Qız qalmaq** – ərə getməmək. *Gülpərinin bəd xasiyyəti onun indiyə kimi qız qalmasına səbəb olmuşdu.* S.S.Axundov. **Qız vermək** – birinə qızını verib onunla qohum olmaq. *Əmir həzrətləri, siyasətlər əksəriyyətlə qız verib, qız almaq və qohum olmaq əsasında qurulubdur.* M.S.Ordubadi. *..Kasıbına mərddi, – dedik; Mərd kasıba qız vermədik.* M.Araz.

**QIZARAQ** *is. bot.* Quru dağ yamaclarında bitən çoxillik ot bitki.

**QIZARDILMA** "Qızardılmaq"dan *f.is.*

**QIZARDILMAQ** *məch.* 1. Qızarıncaya qədər qızdırılmaq, közərdilmək.

2. Qırmızı rəngə boyadılmaq, qırmızı rəngə salınmaq, qırmızılaşdırılmaq, qırmızı rəng sürtülmək.

3. Tavada və s.-də qızarıncaya qədər bişirilmək, qovrulmaq. *Ət qızardılmışdır*.

4. *məc.* Bərk utandırılmaq, qızarmasına, xəcalət çəkməsinə səbəb olmaq.

**QIZARDILMIŞ** *f.sif.* 1. Qırmızı oluncaya qədər qızdırılmış, közərdilmiş. *O, indi körükdə qızardılmış dairəvi bir dəmir parçasına bənzəyirdi.* M.Hüseyn.

2. Şiddətli od üstündə qızarıncaya qədər bişirilmiş; qovrulmuş. *Qızardılmış toyuq. Qızardılmış ət. Qızardılmış balıq.* – [Əşrəf] *qızardılmış bildirçinləri çıxardıb stolun üstünə qoydu..* İ.Şıxlı.

3. Qırmızı rəngə boyanmış. *Qızardılmış parça, bez.*

4. *məc.* Bərk utandırılmış.

**QIZARIQ** *is.* Bədəndə bir yerin qaşınmasından, yaxud başqa səbəbdən əmələ gəlmiş qızartı.

**QIZARIŞMA** "Qızarışmaq"dan *f.is.*

**QIZARIŞMAQ** *f.* Görünmək, qızarmaq (çoxlu qırmızı şey haqqında). *Məhəccər boyu dairə şəklində balaca bostanın dövrəsini bürümüş gül-çiçək elə uzaqdan da qızarışırdı.* M.Hüseyn. *Dağın ətəyində buğda zəmilərinin içindəki lalələr qızarışırdı.* Ə.Vəliyev.

**QIZARMA** "Qızarmaq"dan *f.is.*

**QIZARMAQ** *f.* 1. Çox qızmaqdan qırmızı rəng almaq, közərmək. *Dəmir ocaqda qızardı.*

2. Şiddətli od üstündə tavada və s.-də qırmızı oluncaya qədər qovrulub bişmək. *Ət qızarmışdır. – Təndirin bir tərəfi dolmamış, o biri tərəfdə çörək qızarır, köpürdü..* Mir Cəlal.

3. Qırmızı olmaq, qırmızılaşmaq, qırmızı rəng almaq, allanmaq. *Şaxtadan yanaqları qızarmışdır. Ağlamaqdan* (*tüstüdən və s.-dən*) *gözləri qızarmaq.* – [Fərhad:] *..Gözlərim ağrıyır. Onun üçün bir az qızarıb.* Ə.Haqverdiyev. [Gəlinin] *yanaqları alma kimi qızarmışdır.* Çəmənzəminli. *Al geyib, qızarıb yenə üfüqlər; Bir azdan gözünü açacaq səhər.* S.Vurğun.

4. Yetişmək, dəymək (meyvələr haqqında). *Narlar, zoğallar qızarmağa başlamışdır. Almalar lap qızarıbdır. – Çöllərdə qızararkən şehli moruq kolları; Ha getdimsə uzandı qədim Şirvan yolları.* Ə.Cəmil.

5. Uzaqdan görünmək (qırmızı şey və işıq haqqında). *Yaşıllıq arasında kəndin kirəmit damları qızarır. Taxıl əkininin içində lalələr qızarır.*

6. *məc.* Utanmaq, xəcalət çəkmək. *Sənin yerinə mən qızarmalıyam. – Məmməd Həsən əmi lap karıxdı, .. sonra qızara-qızara* (z.) *üzünü tutdu atlıya.* C.Məmmədquluzadə. *Ara-sıra uşaqlar analarına baxıb, bir də qonaqlarına baxıb qızarırdılar.* M.S.Ordubadi. // Xəcalətindən qan üzünə vurub yanağı qırmızı olmaq, rəng verib rəng almaq (bəzən təşbehlərlə işlənir). *Ruqiyyə mətləbi anladı, ətrafa baxdı, bir kəs yox idi. Dan şəfəqi kimi qızardı.* A.Divanbəyoğlu. // Acıqdan, hirsdən üzünün rəngi dəyişib qırmızılaşmaq. *Sərdar Rəşidin üzü qızarır və yenə də ağarırdı.* M.S.Ordubadi.

◊ **Qızarıb-bozarmaq** – xəcalətdən və ya acıqdan rəng verib rəng almaq. [Məmməd] *güldükcə Əli əmniyyəbaşı qızarıb-bozarırdı.* M.İbrahimov.

**QIZARMIŞ** *f.sif.* 1. Çox qızmaqdan qırmızılaşmış, közərmiş, qıpqırmızı olmuş, köz bağlamış. *Qızarmış dəmir. Qızarmış kömür. – Kürənin daşları pul kimi qızarmış, divarları qovrulurdu.* Mir Cəlal.

2. Od üstündə qovrulub qızarıncaya qədər bişmiş. *Qızarmış ət, balıq.* – [Məşədi Heydər] *..qolunu çırmayıb, qırmızı butalı nimçənin ortasında köndələn yıxılan cücənin qızarmış budundan yapışdı.* B.Talıblı. *Qazanlar buğlanır, dadlı, qızarmış ət qoxusu ətrafa yayılırdı.* M.Rzaquluzadə.

3. Qırmızı olmuş, qırmızı rəng almış. *Qızarmış yanaqlar. Qızarmış gözlər.* – [Turab] *qulluğa yorğun getdi. Qızarmış gözlərinin altı kölgəli idi. Tez-tez əsnəyirdi.* M.Hüseyn. *Kəndlini hirsindən qızarmış görən vəkil özünü itirdi.* Mir Cəlal.

4. Yetişmiş, dəymiş. *Qızarmış narları* (*almaları*) *dərmək.*

**QIZARTDAQ** *sif.* Qırmızıya çalar sarı; kürən. *Əsirlər lagerində bizi qızartdaq saçlı, bulanıq gözlü topal bir alman qarşıladı..* Ə.Məmmədxanlı.

**QIZARTDIRMA** "Qızartdırmaq"dan *f.is.*

**QIZARTDIRMAQ** *icb.* Qızartma işi gördürmək. *Yumurtaları qızartdırmaq. Parçanı verib qızartdırdım. Balığı yağda qızartdırmaq.*

**QIZARTI** *is.* Qırmızı rəng; qırmızılıq. *Züleyxa böyüdükcə gözəlləşirdi; yanaqlarında olan qızartı səhər vaxtı gün çıxmamış şərqdə göy üzünü bürüyən zərif qızartıdan daha gözəl, daha xoş idi.* C.Cabbarlı. // Bədənin bir yerində zəif qırmızı ləkə, hər hansı bir səbəb üzündən qanın bədənin bir yerinə

axıb gəlməsi nəticəsində əmələ gələn qırmızılıq. *Boğazında qızartı var. Bədənindəki qızartılar çəkilmişdir*.

2. Uzaqdan görünən qırmızı şey. *Uzaqdan bir qızartı görünür*. // Şəfəq, parıltı. *Qızartı artır, dan yeri açılır; Göy üzünə al alovlar saçılır*. A.Səhhət. *Getdikcə dan yerinin qızartısı artırdı*. S.S.Axundov. *Qərbdə ürəkaçan bir qızartı, gözqamaşdıran bir parıltı vardı*. M.Hüseyn.

**QIZARTMA** 1. "Qızartmaq"dan *f.is.*

2. *is. aşp*. Tavada və s.-də qızardılmış ət, balıq və s. *Süfrənin üstünə sərin şərbət, toyuq qızartması düzüldü, meyvələr və əlvan yeməklər qoydular*. M.S.Ordubadi.

**QIZARTMAQ** *f.* 1. Qızarıncaya qədər qızdırmaq, közərtmək. *Dəmiri kürədə qızartmaq. Kömürü üfləyib qızartmaq*. – [Şeyx Şəban] *özü çırağına neft töküb yandırırdı, manqala kömür qoyub qızardıb, su qaynadıb özünə çay qayırırdı*. Ə.Haqverdiyev.

2. Qırmızı etmək, qırmızılaşdırmaq, qırmızı rəngə boyamaq. *Yumurtaları qızartmaq. Damları qızartmaq. Günəş almaları qızartdı. Şaxta üzünü qızartmışdır*.

3. Tavada və s.-də qızarıncaya qədər qovurmaq, bişirmək. *Əti, balığı tavada qızartmaq. Çörəyi təndirdə qızartmaq*.

4. *məc.* Utandırmaq, xəcalət çəkdirmək. *Uşağı danlayıb qızartdı*.

**QIZBİBİ** *is. dan.* Həmişə qızlarla oynayan, qızlarla oturub-duran, evdən bayıra çıxmayan, qorxaq, cəsarətsiz, aciz oğlan.

**QIZCIQ** b a x **qızcığaz**. *Dəyişdi günbəgün qızcığın halı; Pozuldu gördüyüm o gül camalı*. S.Vurğun.

**QIZCIĞAZ** "Qız"dan *oxş*. *Qızcığaz bu gecə səhərə qədər qızdırıbdır*. – *Ay qız, Hacı Məhərrəmin, deyirlər, qızcığazı qoşulub qaçıbdır axı*. N.Vəzirov. *Ox .. balaca Aybikənin ayağına dəyib qanatmışdı, qanı görən qızcığaz daha bərkdən çığırmağa başlamışdı*. M.Rzaquluzadə.

**QIZDIRICI** *sif.* Bir şeyi qızdırmağa xidmət edən; isidici. *Qızdırıcı cihaz*. // *is.* İsidici cihaz və s. *Böyük quşçuluq təsərrüfatlarında cücələrin isinməsi üçün mürəkkəb quruluşlu qızdırıcılar tətbiq edilir*.

**QIZDIRILMA** "Qızdırılmaq"dan *f.is.*

**QIZDIRILMAQ** *məch.* 1. İstiləndirilmək, qızğın hala salınmaq, isidilmək. *Dəmir kürədə qızdırıldı. Soba qızdırıldı*.

2. *məc.* Hiddətləndirilmək, acıqlandırılmaq.

**QIZDIRILMIŞ** *f.sif.* Qızğın hala gətirilmiş, istiləndirilmiş, isidilmiş, od üstündə hərarəti artırılmış, isidilmiş. *Qızdırılmış xörək. Qızdırılmış dəmir. Qızdırılmış otaq*.

**QIZDIRMA** *is.* 1. "Qızdırmaq"dan *f.is.*

2. Bədəndə hərarət, istilik. *Uşağın qızdırması var. Xəstənin qızdırması artdı*. – [Turac:] *Bir həftədir ki, uşağım qızdırma içində yanır*. C.Cabbarlı. *Başı .. ağırlaşmış, qulaqları uğuldayır, bədəni uçunurdu. Bir az sonra onu qızdırma apardı*. M.Rzaquluzadə. *Sürəyya qızdırma içində yanırdı*. Ə.Məmmədxanlı.

3. *dan.* İsitmə xəstəliyi, malyariya. *Bir naxoşun üstə həkim gətirəndə, həkim əvvəl yapışır naxoşun nəbzindən, sonra qulağını qoyur döşünə və deyir ki, "sənin azarın, məsələn, qızdırmadır"*. C.Məmmədquluzadə. *Zavallı uşaq qızdırma azarından yeni qalxmış adam kimi ayaq üstündə dayana bilmirdi*. S.S.Axundov. *Bir neçə il bundan əvvəl mən onu qızdırma xəstəliyindən müalicə edirdim*. C.Cabbarlı.

**QIZDIRMAQ** 1. *t-li.* İsitmək, isti eləmək, qızğın hala gətirmək, dağ eləmək. *Suyu qızdırmaq. Xörəyi qızdırmaq. Ütünü qızdırmaq*. – *Uşaqlar, falaqqa hazır edin; Od yandırın, şiş qızdırın*. M.Ə.Sabir. *Yasəmən çayın qırağında su qızdırıb paltar yuyurdu*. S.S.Axundov.

2. *t-li.* Öz hərarətini vermək, keçirmək, qızışmasına səbəb olmaq. *İlk yazı andıran günəşin ilıq şüaları insanın canını qızdırır*. M.İbrahimov.

3. *t-siz.* Bədəninin hərarəti artmaq (bir xəstəlik nəticəsində). *Xəstə bərk qızdırmışdır*. – *Bir gün Əkbər qızdırıb, yüngülcə xəstələndi*. S.Rüstəm. // *dan.* İsitmə xəstəliyi keçirmək, isitmək.

**QIZDIRMALI** 1. *sif.* İsitməli, qızdırma xəstəliyi olan. *Qızdırmalı xəstə*. – *Bəy qəzəbindən qızdırmalı adamlar kimi uçundu*. M.Hüseyn. *Budur, mən iyirmi ildir qızdırmalıyam*. Mir Cəlal. // İs. mənasında. *Qızdırmalılara kinə verirlər*.

2. *zərf* Bədəninin hərarəti qalxmış halda, hərarət içində. *Qızdırmalı halda sayıqlamaq. Qızdırmalı-qızdırmalı ayağa durmaq.*

**QIZĞIN** *sif.* 1. Çox isti, çox qızmış halda olan, yüksək hərarətli; qaynar, yandırıcı. *Qızğın dəmir. Qızğın ütü. Qızğın maşa. Günəşin qızğın şüaları.*

2. *məc.* Coşqun, hərarətli, alovlu, atəşin, ehtiraslı. *Qızğın məhəbbət.* // *məc.* Həyəcanlı, dərin hissləri ifadə edən. *Zavallı, bəxtsiz bacı evdə qardaşının müsibətində qızğın göz yaşları tökdüyü bir zamanda, oğlunun küçədə öldürüldüyünü duyarsa, nə yapa bilər?* S.Hüseyn. *Azərbaycan ədəbi dili qılınc döyüşünü andıran qızğın mükalimələr, kəskin deyişmələr dilidir.* M.İbrahimov.

3. *məc.* Çox gərgin, güclü, şiddətli. *Qızğın mübarizə. İşin qızğın vaxtı.* // *məc.* Ən güclü, ən çox, ən böyük, şiddətli. *Molla Qasımın .. qızğın alış-verişi el dağa köçən zaman və dağdan enən zaman olardı.* S.S.Axundov. *Qızğın alver məskəni olan Bazar küçəsi qoçuların gəlir yeri idi.* A.Şaiq. "*Tərlan*" *qızğın bir çapışla irəli atılır, qabağına nə gəlirsə vurub keçirdi.* Ə.Məmmədxanlı.

**QIZĞINLAŞMA** "Qızğınlaşmaq"dan *f.is.*

**QIZĞINLAŞMAQ** *f.* 1. Daha da qızğın olmaq. *Alov get-gedə qızğınlaşırdı.*

2. *məc.* Daha da şiddətlənmək, gərginləşmək, güclənmək, dərinləşmək, qızışmaq. *Mübarizə qızğınlaşdı.*

3. *məc.* Azğınlaşmaq, qızmaq, hiddətlənmək, qəzəblənmək, şiddət göstərmək.

**QIZĞINLIQ** *is.* 1. Qızğın şeyin halı. *Dəmirin qızğınlığı. Günəşin qızğınlığı. – Məhbusi, böyük bir ürək qızğınlığı ilə qollarını onun boynuna salıb qucaqladı.* M.İbrahimov.

2. *məc.* Canlanma, fəaliyyət, hərəkət. *Bir həftə əvvəldən istər aşağı bazarda, istərsə də yuxarı bazarda bir qızğınlıq müşahidə edilirdi.* H.Sarabski.

**QIZIL** 1. *is.* Rəngi sarı, bahalı bəzək şeyləri və s. qayrılan və dəyər vahidi kimi işlədilən qiymətli metal. *Xalis qızıl. Qızıl mədəni.* ◻ **Qızıl bahasına** – çox baha qiymətə. **Qızıl suyuna çəkmək** – qızıl olmayan metalın üstünə qızıl rəngi vermək. **Qızıla tutmaq** – qızıl ilə örtmək, qızıl ilə bəzəmək. // *Sif. mənasında*. Qızıldan qayrılmış. *Qızıl üzük. Qızıl qolbaq. Qızıl diş. Qızıl pul.* – [Onlar] *qızıl avizələrlə bəzənmiş böyük salona girdilər.* M.S.Ordubadi. // *Sif. mənasında*. Qızıl çərçivəyə salınmış, qızıla geydirilmiş, qızılla bəzədilmiş. *Qızıl gözlük. Qızıl qaşlı xəncər.* // *is.* Qızıldan qayrılmış şeylər; qızıl pul.

2. *sif.* Al, qırmızı. *Şahin-şunqar sürbənizi dağıdar; Boyanarsız qızıl qana, durnalar!* M.V.Vidadi.

3. *sif. məc.* Bolşevik inqilabı, sosializm quruluşu, sovet sosialist üsuli-idarəsi ilə əlaqədar olan (b a x **qırmızı** 3-cü mənada). ◻ **Qızıl əsgər** *tar.* – Qırmızı ordu döyüşçüsü. *Hücum əmrini gözləyən hər bir qızıl əsgər bütün diqqətini toplayaraq, təyyarə səsini eşitməyə çalışırdı.* M.S.Ordubadi. **Qızıl Ordu** – sovet ordusunun 1918-ci ildən 1946-cı ilə qədər adı.

4. *sif.* Qızıl rəngində olan, parlaq sarı, qızıl kimi bərq vuran. *Günəş qızıl saçlarını dərələrdən, meşələrdən yavaş-yavaş toplayaraq qərbə .. doğru uzanmağa başlamışdı.* A.Şaiq. *Günəş sonra yavaş-yavaş qalxıb, .. qızıl zərrələrini aləmə dağıdıb, bütün yatmışları oyatdı.* S.S.Axundov.

5. *sif. məc.* Çox qiymətli, çox dəyərli, çox ləyaqətli, çox gözəl, çox yaxşı. [Nəbi kişi:] *Bu dünyada bizim bu kolxoz adamının mislibərabəri hanı? – deyirdi. Qızıl kimi adamlardır, lap qızıl kimi!* S.Rəhimov. ◻ **Qızıl sözlər** – çox ağıllı, faydalı sözlər, məsləhətlər və s. haqqında. **Qızıl əllər** – əlindən hər cür iş gələn, bacarıqlı, məharətli adam haqqında. *Bağlanıb xalqa məhəbbətlə ürək telləriniz; Ağ qızıl yığdı məharətlə qızıl əlləriniz.* S.Rüstəm.

6. *sif. dan.* Heç şeydən çəkinməyən, bozsifət, utanmaz. *Qızıl adam.*

◊ **Qızıl yumurta bayramı** – xristianların pasxa bayramının xalq arasında adı.

**qızıl...** – bəzi mürəkkəb bitki və heyvan adlarının birinci tərkib hissəsi; məs.: qızılağac, qızılgül, qızılbalıq, qızılquş.

**QIZILAĞAC** *is. bot.* Meşələrdə və su kənarlarında bitən iri, enli yarpaqlı qırmızımtıl ağac.

**QIZILAĞACLIQ** *is.* Qızılağac meşəsi, qızılağac çox bitən yer.

**QIZILBALIQ** *is. zool.* Çəhrayı rəngli zərif əti olan, çox qiymətli iri balıq növü. *Saysız-hesabsız .. qızılbalıq və çox qiymətli başqa balıq cinsləri kürü tökmək üçün şimal çaylarına və eləcə də Sibir çaylarına çıxır.* "Sualtı aləm". *Qızılbalıqlar quyruq üstə qalxır, ağızlarını açır və təpəsi aşağı özlərini suya vururdular*. S.Rəhimov.

**QIZILBAŞ** *is. tar.* 1. İranda Şah İsmayıl Səfəvi dövründə qoşunun adı (bu qoşunun döyüşçüləri başlarına qırmızı bağladıqlarına görə belə adlanırdı). [Heydər bəy:] *İndi nə at çapmaq olur, nə ordu dağıtmaq olur, nə qızılbaş döyüşü var..* M.F.Axundzadə.

2. Şiə məzhəbinə mənsub olanlara keçmişdə verilən ad.

**QIZILBAYRAQLI** b a x **qırmızıbayraqlı**.

**QIZILBƏNDLİ** *sif.* Bəndi qızıldan olan. *Qulam xan .. gözlərində qızılbəndli çeşmək o tərəfə-bu tərəfə dolanıb başına hərəkət verirdi.* M.S.Ordubadi.

**QIZILBOZ** *sif.* Qırmızıya çalar boz rəngli. *Qızılboz at.*

**QIZILBÖCƏK** *is. zool*. Rəngi tünd-yaşıl, üstü parıldayan xırda böcək.

**QIZILCA** 1. *is. tib*. Bədəndə səpgi və isitmə ilə təzahür edən yoluxucu uşaq xəstəliyi. *Qızılca çıxartmaq*. *Qızılca xəstəliyi.*

2. *sif.* Qırmızımtıl, qırmızıya çalar rəngdə olan.

**QIZILCALI** *sif. tib*. Qızılca xəstəliyinə tutulmuş. *Qızılcalı uşaq*.

**QIZILCIQ** *is. bot.* 1. Noxud boyda, qırmızı rəngli, çəyirdəkli meyvəsi olan tikanlı ağac və bu ağacın meyvəsi.

2. B a x **qızılca** 1-ci mənada.

**QIZILÇƏTİR** *is. bot.* Çəmənlərdə, rütubət yerlərdə bitən ot bitkisi (bəzi növləri xalq təbabətində işlənir). *Qızılçətir bir və ya ikiillik xırda bitki olub, rozetka təşkil edən yumurtaşəkilli kökyanı yarpaqları vardır*. Əliyev.

**QIZILÇUBUQOTU** *is. bot.* Meşəli yerlərdə bitən ballı bitki.

**QIZILDİŞ(Lİ)** *sif.* Dişi, ya dişləri qızıldan olan. *Şişmanqarınlı, qızıldişli fabrik-zavod sahibləri .. gəzişir, hər birisi özünün iç üzünü göstərirdi.* H.Nəzərli.

**QIZILGÖZ** *is. zool.* Qırmızı gözlü kəpənək növü. *Ən çox yayılmış tırtıllar yemişan kəpənəyi və qızılgöz adlanan kəpənəklərin tırtıllarıdır ki, bu tırtıllardan sonradan həmin kəpənəklər əmələ gəlir*. "Zoologiya".

**QIZILGÜL** *is.* Kiçik, tikanlı kolda bitən, müxtəlif rənglərdə olan ətirli bir gül. *Qızılgülün ürəyə xoş gələn ətri otağa yayıldı. – Qızılgül olmayaydı; Saralıb solmayaydı; Bir ayrılıq, bir ölüm; Heç biri olmayaydı.* (Bayatı). // Xalçada və s.-də bu şəkildə naxış.

**QIZIL-GÜMÜŞ** *top*. Qızıldan və gümüşdən düzəldilmiş şeylər, yaxud pul. *Deyirlər ki, Bağdad xəlifəsinə köçürülən Məlik şah Sultanın qızı ilə nəfis qumaşlar və qızıl-gümüş şeylərlə yüklənmiş sırma örtüklü 130 qatar dəvə .. cehiz olaraq göndərilmişdi.* A.Bakıxanov.

**QIZILXALLI** *sif.* Üzərində qızıl (qırmızı) xalları olan, qızıl xallarla örtülü. *Qızılxallı balıq.*

**QIZILI** *sif.* Qızıl rəngində olan, parlaq sarıya çalan. *Qızılı şal. – Qızılı saçlarından yağan yağış süzülür*. M.Rahim. *Payızda o da anasına qoşulub pambıq yığırdı. Bu zaman pambıq kolları qızılı bir rəng alır.* İ.Əfəndiyev. *Bu feldşer .. saçı və kirpiyi alov kimi qızılı rəngə çalan, çöhrəsi ötəri çil, özü də mavi gözlü bir qızdı.* Ə.Əbülhəsən.

**QIZILQAZ** *is. zool.* Zərif çəhrayı tüklü, qanadları qızıl kimi parlaq uzunboğaz və uzunqıç su quşu.

**QIZIL-QIRMIZI** b a x **qızıl** 4-cü mənada.

**QIZILQURD** *is.* Atların bağırsaqlarında əmələ gələn qurd xəstəliyi.

**QIZILQUŞ** *is. zool.* 1. Ov üçün istifadə edilən alıcı quş növlərindən biri. *Qızılquşun ensiz və yığcam bədəni üzərində olan bir cüt ensiz qanad və uzun quyruq ona çox sürətlə və asanlıqla uçmağa imkan verir.* "Zoologiya". *Ovçular qızılquş, tazı, tula götürüb ova çıxırlar*. A.Şaiq. // İtigözlülük, cəldlik, çeviklik, qocalıq simvolu kimi. *Silahlı qardaşım, sərhəd boyunca; Alıcı gözlərin qızılquş olsun.* S.Vurğun. *El içində artsın tayıntuşun sənin; Boş dönməsin ovdan qızılquşun sənin*. M.Rzaquluzadə.

2. Qanadları qabıq kimi sərt, yaşıl, şəffaf, yumrutəhər bir cücü.

**QIZILQUYRUQ** *is. zool.* Quyruğu qırmızıya çalar sarı rəngli quş.

**QIZILLAMA** "Qızıllamaq"dan *f.is.*

**QIZILLAMAQ** *f.* Qızıla tutmaq, üstünə qızıl çəkmək, ya qızıl suyu vermək.

**QIZILLANMA** "Qızıllanmaq"dan *f.is.*

**QIZILLANMAQ** *məch.* Qızıla tutulmaq, qızılla örtülmək, qızılla bəzənmək.

**QIZILLAŞDIRMA** "Qızıllaşdırmaq"dan *f.is.*

**QIZILLAŞDIRMAQ** *f.* 1. Qızıla tutmaq, üstünə qızıl çəkmək və ya qızıl suyu vermək.

2. Qırmızılaşdırmaq.

**QIZILLAŞMA** "Qızıllaşmaq"dan *f.is.*

**QIZILLAŞMAQ** *f.* Qırmızılaşmaq.

**QIZILLATMA** "Qızıllatmaq"dan *f.is.*

**QIZILLATMAQ** *icb.* Qızıla tutdurmaq, üstünə qızıl çəkdirmək və ya qızıl suyu verdirmək.

**QIZILLI** *sif.* Qızıl vurulmuş, qızıl ilə bəzənmiş. [Əminə] *..ətəyi qızıllı, qəşəng al faydan kofta geymiş, başına da heyratı kəlağayı örtmüşdü.* Ə.Əbülhəsən.

**QIZILLIQ** *is.* 1. Qırmızılıq, qırmızı şeyin halı.

2. *məc. dan.* Utanmazlıq, həyasızlıq, heç bir şeydən çəkinməzlik.

**QIZILÖZƏK** *is.* Qida borusunun xalq arasında adı.

**QIZILPƏNCƏR** *is. bot.* Yayda bitən, yeyilən bir bitki.

**QIZILSAQQAL** *is. bot.* Aran və dağlıq yerlərdə, yamaclarda, kolluqlarda bitən bitki (xalq arasında şotka və s. hazırlamaq üçün istifadə edilir).

**QIZILSÖYÜD** *is. bot.* Söyüd ağacının bir növü.

**QIZILULDUZLU** *sif.* Üzərində qırmızı ulduz nişanı olan. *Qızılulduzlu təyyarə. Qızılulduzlu papaq. – Bu qızılulduzlu bayraq sənindir; Biliyə, zəkaya, əməyə hörmət!* A.Şaiq.

**QIZILYEL** *is. tib.* Yoluxucu dəri xəstəliyi.

**QIZILZANBAQ** *is. bot.* Dağlıq yerlərdə bitən soğanaqlı bitki.

**QIZINDIRMA** "Qızındırmaq"dan *f.is.*

**QIZINDIRMAQ** *f.* Odda, istidə qızdırmaq, isindirmək, istiləndirmək.

**QIZINMA** "Qızınmaq$^1$"dan *f.is.*

**QIZINMAQ$^1$** *qayıd.* Odun və ya günəşin qabağında, yaxud bir şeyin istisində öz bədənini qızdırmaq, istiləndirmək; isinmək. [Onlar] *xırda qruplara ayrılıb, günün istisində qızınır və söhbət edirdilər.* M.S.Ordubadi. *Mən istədim ki, sizdə bir az qızınıb rahat olam.* S.S.Axundov. *Mahmud və yoldaşı çay içdikdən sonra, bir az qızınıb hallandılar.* B.Talıblı. // Məc. mənada. *İlk yaz günəşi ilə qızınan torpaq da sanki adamlar kimi .. nəfəs alır, ayılırdı.* M.İbrahimov.

**QIZINMAQ$^2$** b a x **qızmaq$^2$**. *Bütün Təbrizdə sizdən başqa qızınıb etibar edəcəyim bir nəfər də adam tanımıram.* M.F.Axundzadə.

**QIZIRĞALANMAQ** b a x **qızırğa(n)maq**.

**QIZIRĞA(N)MAQ** *f.* Müzayiqə etmək, əsirgəmək, heyfi gəlmək, xəsislik etmək, verməyə əli getməmək, bir şeyi başqasına çox görmək. *Utanmırsan, 9 manatı qızırğanırsan, sənin yanında bizim doqquz manatlıq da xatirimiz yoxdur?* C.Məmmədquluzadə. [Gülpəri:] *Hərgah istəyirsən ki, iş düzəltsin, gərəkdir ki, pula qızırğanmayasan.* N.Nərimanov.

**QIZITMA** "Qızıtmaq"dan *f.is.*

**QIZITMAQ** *f.* Qızdırmaq, istiləndirmək, isitmək. *Soyuqdan donmuş bədənimi öz tələbə otağımın isti havasında qızıtmağa tələsirdim.* T.Ş.Simurq.

**QIZIŞDIRICI** *is.* Təhrikçi, araqarışdıran. ☐ **Müharibə qızışdırıcı** – b a x **müharibə qızışdıran** ("**qızışdırmaq**"da).

**QIZIŞDIRICILIQ** *is.* Təhrikçilik, araqarışdırıcılıq, ara qarışdırma.

**QIZIŞDIRILMA** "Qızışdırılmaq"dan *f.is.* *Mübarizənin qızışdırılması. Mübahisənin qızışdırılması.*

**QIZIŞDIRILMAQ** *məch.* 1. Alovu daha da şiddətləndirilmək; alovlandırılmaq.

2. Qızdırılmaq, isidilmək, istiləndirilmək.

3. *məc.* Şiddətləndirilmək; qüvvəsi, şiddəti, gərginliyi və s. daha da artırılmaq.

4. *məc.* Hirsləndirilmək, acıqlandırılmaq, coşdurulmaq.

5. *məc.* Təhrik edilmək, salışdırılmaq.

**QIZIŞDIRMA** "Qızışdırmaq"dan *f.is.*

**QIZIŞDIRMAQ** *f.* 1. Odun alovunu daha da şiddətləndirmək; alovlandırmaq. *Ocağı üfürüb qızışdırmaq. Uşaqlar tonqalı qızışdırdılar.*

2. Qızdırmaq, isitmək, istiləndirmək. *Əllərimi oda tutub bir az qızışdırdım. – Qızışdırar*

*bahar ayı yerin, göyün havasını; Dəyişdirər, tünüklədər xəlaiqin libasını.* A.Səhhət.

3. *məc.* Şiddətləndirmək; bir şeyin qüvvəsini, şiddətini, gərginliyini və s.-ni daha da artırmaq. *Mübahisəni daha da qızışdırmaq. Ədavəti qızışdırmaq.* ☐ **Müharibə qızışdıran** – işğalçılıq müharibəsi təbliğ edən, işğalçı. *Müharibə qızışdıranlar nə qədər fitnəkar olsalar da, onlar nə qədər qızğın təbliğat aparsalar da öz məqsədlərinə nail ola bilməyəcəklər.* S.Vurğun. // *məc.* Daha da canlandırmaq, fəallaşdırmaq. *Məclisi qızışdırmaq. Söhbəti qızışdırmaq. – Məşədi Heydər məclisi qızışdırmaq üçün söz atdı.* B.Talıblı.

4. *məc.* Hirsləndirmək, acıqlandırmaq, coşdurmaq. *Ayrım qızı Kərim babanı qızışdırmaq fikri ilə əlini onun çiyninə vuraraq, deyirdi: – Bu yaramazı görürsünüzmü? Aylarca üzünü görməzdim; işi nə idi? Boşboğazlıq.* A.Şaiq. *Usta nə qədər çalışdısa, arxitektoru qızışdıra bilmədi.* M.İbrahimov.

5. *məc.* Təhrik etmək, birini başqasının üstünə salışdırmağa çalışmaq. [Vaqif:] *Bunlar hamısı məliklərin işidir, – dedi, – xalqı qızışdırıb avara qoyurlar.* Çəmənzəminli.

6. *məc.* Döymək, əzişdirmək. [Mərdan] *hacının yaxasından tutub yastıq kimi yerə atdı, üstündə oturdu, baş-qulağını qızışdırdı.* Mir Cəlal.

**QIZIŞQAN** *sif.* Qudurğan, azğın, qızışmış.

**QIZIŞQANLIQ** *is.* Qudurğanlıq, azğınlıq, qızğınlıq.

**QIZIŞMA** "Qızışmaq"dan *f.is.*

**QIZIŞMAQ** *f.* 1. Qızmaq, istiləşmək, hərarətlənmək; canı qızmaq, bədənində xoş bir istilik hiss etmək, soyuqluğu rəf olmaq. *Soyuqdan donmuş bədənim qızışdı. Havalar qızışmışdı. – Cəbiş danışmaqla öz-özünə sığınır, bədənini qızdırır, onun paltarı da qızışır, içəridən buğlanırdı.* S.Rəhimov. *Sadıq dalbadal bir neçə stəkan tünd çay içib qızışdı, rahatlandı.* Mir Cəlal.

2. Daha da şiddətlənmək, güclənmək. *Yanğın qızışaraq ətrafa yayıldı. – Mübahisə getdikcə daha da qızışır.* S.S.Axundov. *Dostlar arasında başlanmış mübahisə hər an qızışırdı.* M.Hüseyn.

3. *məc.* Özündən çıxmaq, hirslənmək, qızmaq, acığı tutmaq. *Səlimi danışdıqca qızışır və geri dönmək mümkün olmadığını görüb .. heç şeydən qorxmadan düşündüyünü deyirdi.* M.İbrahimov. *Xan büsbütün qızışıb qəzəblə bağırdı.* M.Rzaquluzadə.

4. Qıcqırmaq, çox qalıb turşumaq, xarab olmaq (sirkə və s.).

**QIZIŞMIŞ** bax **qızmış**. *Qızışmış fayton atları dördnala çaparaq, şose yolunun daşlarından qığılcım qoparırdı.* M.Hüseyn.

**QIZQUŞU** *zool.* bax **qızlarquşu**.

**QIZLARAĞASI** *is. tar.* Hökmdarın hərəmxanasına nəzarət edən saray xidmətçisi. *Əndərun, birun, qısqanc xədimlər, sərt qızlarağası, qürbət... Bütün bunları düşündükcə Kiçikbəyimin ürəyi sıxılırdı.* Çəmənzəminli.

**QIZLARQUŞU** *is. zool.* Sığırçın boyda kiçik, bel və qanadlarının tükləri yaşıl bir quş. *Bizim aran yerlərində* [arıların] *birinci düşməni qızlarquşudur. Qızlarquşu köçəri quşdur, .. onlar dəstə ilə arı suya gedən yolu kəsib, onları tutub yeyir.* H.Zərdabi.

**QIZLIQ** *is.* 1. Qadın cinsinin ərə gedincəyə qədər olan halı, qız olma dövrü. *Qızlıq dövrü qadın həyatının ən mühüm dövrüdür.* M.S.Ordubadi. [Məsmə:] *İndi öz otağıma daşındıqda, ta qızlığımdan xəyalımda nəqşəsini çəkdiyim otağı hazırlamağa başladım.* S.Hüseyn. *Tükəzban xalanın qızlığından bir azarı vardı ki, indiyəcən başından çıxmamışdı.* B.Talıblı.

2. Bəkarət.

3. Biri tərəfindən övladlığa götürülmüş qız uşağı, yaxud ana ardınca bir kişinin evinə gətirilən qız uşağı. [Səkinə xanım:] *Ümidim budur ki, məni qızlığa qəbul edib, mənim bu dar günümdə köməyini məndən əsirgəməyəsən.* M.F.Axundzadə.

**QIZMA¹** "Qızmaq¹"dan *f.is.*

**QIZMA²** "Qızmaq²"dan *f.is.*

**QIZMAQ¹** *f.* 1. Bərk istilik almaq, hərarət almaq, çox istilənmək, hərarəti artmaq. *Su qızmamışdır. Havalar getdikcə qızır. – Qızdı günəş, əsdi isti yellər; Qarlar əridi, axışdı sellər.* A.Şaiq. *..Otağa cənub küləyinin ılıq şüaları dolur, beləliklə, ev bir az daha qızırdı.* Ə.Əbülhəsən.

2. *məc.* Hirslənmək, hiddətlənmək. *..Bakıya dönməyi israr və təkid edərkən rədd cavabı alınca* [Əhməd] *qızaraq: – Bilmi-*

*rəm, bu nə ölümdür... – demişdi*. A.Şaiq. *Əşrəf, anasının bu böyük xəbəri etinasız qarşılamasına qızdı.* Mir Cəlal.

3. *məc.* Qızışmaq, coşmaq. *Çırmanırıq keçməyə çay gəlməmiş; Başlayırıq qızmağa yay gəlməmiş*. M.Ə.Sabir.

**QIZMAQ**[2] *f. dan.* İnanmaq, etibar etmək, bel bağlamaq, xatircəm olmaq, arxayın olmaq (çox vaxt "ürəyi" sözü ilə bərabər). *Ona heç qızmaq olmur.* – [Şəhrəbanı xanım:] *De görüm, ürəyim dürüst qızasıdırmı? Çünki bu iş çox çətin işdir.* M.F.Axundzadə. [Şahnisə xanım:] *Axı, ürəyim qızmır, – dedi, – yad ölkə, uzaq yer*.. Çəmənzəminli. *Hacı ilk dəfə bu məsələni ürəyi qızan adamlara açdı*. Mir Cəlal.

**QIZMAR** *sif.* Çox qızğın, yandırıcı, qaynar. *..O, bu yırtıcı odların acıqlı qoynunda, mənasız cəhənnəmin qızmar dişlərində məhv olur.* C.Cabbarlı. *Şamama .. böyüyüb yaşa dolduqca çöl çiçəkləri kimi qızmar günəşin .. altında, təbiətin hər cürə tüğyanına öyrəşirdi*. İ.Əfəndiyev. *Şaxta qızmar bir dəmir kimi onu dağlayır*. Ə.Məmmədxanlı. // *is.* Çox isti hava, havanın çox isti vaxtı. *Yayın qızmarında, qışın şaxtasında həmişə çıl-çılpaq kürək çəkib, qan-tər içində olan bu bədbəxtlər ömürlük bu əzaba məhkum idilər.* M.Rzaquluzadə.

**QIZMARLIQ** *is.* Qızmar şeyin halı; çox qızğınlıq, yandırıcılıq, qaynarlıq.

**QIZMIŞ** *sif.* 1. Od üstündə qalaraq yüksək hərarət almış, yandırıcı dərəcədə istilənmiş. *Yaşıl qədəkdən uzun arxalıq geymiş, başına qırmızı sarıqlı sərpuş qoymuş bir sehrkar ocaqda qızmış ərsini dilinin üstünə basırdı.* Çəmənzəminli.

2. *məc.* Özündən çıxmış, qızışmış, coşmuş, azğın. *Qızmış dəvə. Qızmış öküz.* – *Rövşən qızmış pələngə döndü.* "Koroğlu". *Hər vuranda yetmiş bədən sərilərdi birdən yerə; Kişnədikcə qızmış Qırat, səs düşərdi dərələrə.* R.Rza.

**QİBLƏ** *is.* [*ər.*] 1. Namaz qılarkən müsəlmanların üzlərini çevirdikləri tərəf (Məkkədə müqəddəs sayılan Kəbə adlı binanın səmti). *Burada axund molla Tağı durdu namaza, üzünü qibləyə çöndərdi*. C.Məmmədquluzadə.

2. Cənub, cənub tərəf. *Külək qiblədən əsir.* – *Səhər-səhər sərin qiblə yelləri; Heç yolun düşdümü canan dağına?* M.P.Vaqif. *Belə kölgəlik tikəndə, gərək elə tikilsin ki, səbətləri üzü qibləyə qoymaq* [mümkün] *olsun*. H.Zərdabi. *Ağıçı Bədircahanın evi şəhərin qiblə tərəfində, qayanın üstündə, çox basəfa olan yerdədir*. N.Vəzirov.

◊ **Qibleyi-aləm** *köhn.* – müsəlman Şərqində hökmdara müraciət forması. [Böyükxanım:] *Azərbaycan xalqı qibleyi-aləmin qurduğu üsuli-idarəni istəmir*. M.S.Ordubadi. *Şah hiddətlə dedi: – Sadıq xan, sən də belə!.. Bir demirsən ki, niyə Məmməd bəy qibleyi-aləmin hüzuruna gəlmir?..* Çəmənzəminli.

**QİBLƏGAH** *is.* [*ər.* qiblə və *fars*. ...gah] 1. *din.* Qiblə yeri, qiblə tərəfi (bax **qiblə** 1-ci mənada).

2. Keçmişdə padşahlara verilən ünvanlardan biri. *Əsrin padşahını, əhalinin yüz illərcə ölüsünün və dirisinin sahibi və qibləgahı xoruz şəklinə salmaq mümkün imiş.* C.Məmmədquluzadə.

3. *məc. şair. tənt*. Klassik ədəbiyyatda gözəlin, sevgilinin epitetlərindən biri. *Gər sənin yüzün degil aşiqlər üçün qiblәgah; Bəs nədən buldu hilal qaşların mehrablər?* Xətayi. *Qaşlarının tağı qiblәgahımdır; Fəda qılım din-imanı mən sənə.* M.P.Vaqif.

**QİBLƏNÜMA** *is.* [*ər.* qiblə və *fars*. ...nüma] Kompasın köhnə adı. *O zamanlar hələ yoxmuş qiblənüma; Bilən yoxmuş elmin böyük qüdrətini*. S.Vurğun.

**QİBT** *is.* [*ər.*] Sonralar ərəblərlə qarışmış qədim Misir əhalisinin adı.

**QİBTƏ**[1] *is.* [*ər.*] Başqasının üstünlüyünü, müvəffəqiyyətini, xoşbəxtliyini və başqa yaxşı cəhətlərini görüb, bunların özündə də olmasını arzulama, bunların həsrətini çəkmə. *Cəmil Tahiri tanıdı və onun məharətinə qibtə ilə baxıb, xəfifcə bir tərzdə gülümsədi.* M.Hüseyn. [Şagirdlərdən] *bir çoxu hörmət, bəzisi də qibtə hissi ilə Mehmanın vəsiqəsinə baxmaq istəyirdi.* S.Rəhimov. *Nərgiz xanımın kitabxanası isə həkimlər aləmində qibtə doğuran çox zəngin kitabxana idi.* Ə.Məmmədxanlı. □ **Qibtə etmək** – başqasının üstünlüyünü, müvəffəqiyyətini, xoşbəxtliyini və

başqa yaxşı cəhətlərini görüb, bunların özündə də olmasını arzu etmək, həsrətini çəkmək. *Əhməd Əşrəf kimi yoldaşlarına qibtə edərək:* "*Bəxtiyar adamlar!*" *deyirdi*. A.Şaiq. *Müdərrislərimiz ondakı məharətə qibtə edirdilər.* İ.Əfəndiyev. *Qibtə edəsiniz də mənə, şübhəsiz, siz məndən min dəfə bəxtəvərsiniz*. O.Sarıvəlli. // Bəzən paxıllıq mənasında da işlənir.

**QİBTƏ²** *is.* [*ər.*] Kompas, qibləni göstərən.

**QİBTƏKEŞ** *sif.* [*ər*. qibtə və *fars*. ...keş] Qibtə çəkən, qibtə edən.

**QİBTİ** *is.* [*ər.*] 1. Qibt qövmünə mənsub olan adam (b a x **qibt**).

2. Misirdən keçərək, Avropanın bəzi ölkələrinə yayılmış qaraçılara verilən ad.

**QİDA** *is.* [*ər.*] 1. İnsan və heyvan orqanizminin və bitkilərin yaşaması üçün lazım olan bəsləyici maddələr, yeyilən və içilən şeylər. *Qida maddələri. İnsanın qidası. Sağlamlıq üçün lazım olan şərtlərdən biri də qidanın düzgün və vaxtında qəbul olunmasıdır*. // Yemək, xörək. ◻ **Qida verən** – qidalandıran, bəsləyici. [Mürşüd:] *Mən gedirəm işə, sən get evə. Bədənə qida verən şeylərdən bir qədər hazırla*. S.Rəhman.

2. *məc.* Bir şeyi yaşatdıran, canlandıran, ruhlandıran, nəşə verən amil mənasında. *Musiqi ruhun qidasıdır. Dünyada elə adamlar vardır ki, onlar yalnız elmi söhbətlərdən mənəvi qida alırlar*. M.S.Ordubadi. // *məc.* Bir şey üçün mənbə olan, material verən əsas mənasında. *Xalq yaradıcılığından qida almaq. İnsanlarımızın fədakarlıq və qəhrəmanlığı öz qidasını Vətənimizin tarixindən alır.* ◻ **Qida vermək** – bir şeyin meydana gəlməsinə, yayılmasına şərait və imkan yaratmaq, kömək etmək.

◊ **Qida borusu** *anat.* – bağırsaqların ağız boşluğunu mədə ilə birləşdirən boruşəkilli hissəsi.

**QİDALANDIRICI** *sif.* Qida verən, bəsləyici, qida üçün yararlı, cana faydalı. *Qidalandırıcı maddələr*.

**QİDALANDIRILMA** "Qidalandırılmaq"dan *f.is.*

**QİDALANDIRILMAQ** *məch.* Qida verilmək, yedirilib-bəslənilmək; yedirilmək, bəslənmək.

**QİDALANDIRMA** "Qidalandırmaq"dan *f.is.*

**QİDALANDIRMAQ** *f.* Qida vermək, yedirib-bəsləmək, yedirmək. *Uşağı vaxtlı-vaxtında qidalandırmalı. Bədəni qidalandıran maddələr. Mədəni gübrələr bitkiləri qidalandırır.*

**QİDALANMA** "Qidalanmaq"dan *f.is.*

**QİDALANMAQ** *f.* Qida almaq, bəslənmək, qida ilə təmin olunmaq, qida kimi qəbul etmək, yeyib-içmək. *Meyvə ilə qidalanmaq. Heyvanlar bitkilərdən fərqli olaraq qeyri-üzvi maddələrlə qidalana bilmirlər.*

**QİDALI** *sif.* Tərkibində bəsləyici maddələr olan, orqanizmi qidalandıran. *Qidalı yemək. Qidalı yemlər. Qidalı maddələr.*

**QİDALILIQ** *is.* Qidalı olma, bəsləyici olma; bəsləyicilik; qidalı şeyin keyfiyyəti. *Yeməyin qidalılığı. Yemin qidalılığı. At südündən müalicə əhəmiyyəti və yüksək qidalılığı olan qımız hazırlanır.*

**QİDASIZ** *sif.* Qidası olmayan, tərkibində qida maddələri olmayan və ya çox az olan. *Qidasız maddə. Qidasız yemək.*

**QİDASIZLIQ** *is.* Qidasız şeyin keyfiyyəti; qidanın, qida maddələrinin olmaması, ya azlığı.

**QİLAF** *is.* [*ər.*] Qın, silah qabı. *Onlar öz bəxtlərini bir daha sınamaq üçün qılınclarını qılafından çıxarmaq istəyirlər*. M.S.Ordubadi. // Bir şeyin üstünü örtən sərt qabıq.

**QİLAFLI** *sif.* Qilafı olan, qınlı.

**QİLMAN** *is.* [*ər.*] Dindarlara görə, cənnət xidmətçiləri, behişt xidmətçiləri.

**QİLÜ QAL** *is.* [*ər.*] Mübahisə, dedi-qodu, söz, danışıq. *Mehrü məhəbbətin gecə bu minval; Çıxar aralıqdan olan qilü qal.* Q.Zakir. *Dedim: cahanda nədir bunca qilü qalə səbəb?* S.Ə.Şirvani. *Mən çəkdiyim xalqın qilü qalıdır*. Aşıq Ələsgər. // Dava, dalaşma, qalmaqal, səs-küy, çığır-bağır. *İskəndər bir söz deməyib bir qədər fikirli durur. Bu hində eşikdə qilü qal və qaçhaqaç qopur.* C.Məmmədquluzadə. *Ancaq bizi qorxuda bilməz bu qilü qal.* R.Rza. *İlan vuran ala çatıdan qorxan kimi, Güllü arvadın gözləri də qilü qaldan bərk qorxmuşdu*. S.Rəhimov. ◻ **Qilü qal etmək (salmaq)** – səs-küy salmaq, dalaşmaq.

*Amma uşaq-muşaqlar samanlığa doluşub çox qilü qal salırdılar.* Qantəmir.

**QİLÜ QALÇI** *sif.* və *is.* Qilü qal salan, qalmaqalçı, davakar, dava-dalaş salan, səs-küy salan.

**QİLÜ QALÇILIQ** *is.* Qilü qal salan adamın xasiyyəti; qalmaqalçılıq, səs-küy salma, dava-dalaş salma, davakarlıq.

**QİNA[1]** *is.* [*ər.*] *köhn.* Xanəndəlik; nəğmə, hava oxuma; vokal. *Avropa səliqəsi ilə keçilən qina dərsləri oxuyanın avazını qüvvətləndirir, səsini artırır və gözəlləşdirir.* Ü.Hacıbəyov.

**QİNA[2]** *is.* [*ər.*] *köhn.* 1. Qənaətlənmə.

2. Zənginlik, var-dövlət.

3. Sərvət.

**QİRAƏT** *is.* [*ər.*] Müəyyən üsul və qayda ilə oxuma. *Qiraət dərsi. – ..Axşam vaxtı oraya adamlar cəm olub, söhbətə, qiraətə, musiqiyə məşğul olurlar.* C.Məmmədquluzadə. *Aqil şeri bərkdən və qiraətlə* (z.) *oxuyurdu.* Ə.Vəliyev. // Ümumiyyətlə oxuma; mütaliə. *Qiraət etmək. Qiraətlə məşğul olmaq.* ☐ **Qiraət zalı (otağı)** – qəzet, kitab və s. oxumaq üçün zal, otaq, qiraətxana, mütaliə otağı. *Qiraət zalında Vahidin bir masası vardı.* Mir Cəlal.

◊ **Qiraət koması** – kəndlərdə mədəniyyət sarayları meydana gəlmədən qabaq: mədəni-maarif ocağı. [Cahan:] *Hər yerdə qiraət koması açılır.* Ə.Haqverdiyev. *Məktəb uşaqlarının köməyi ilə tarla düşərgəsində qəşəng bir qiraət koması düzəlmişdi.* Ə.Vəliyev.

**QİRAƏTÇİ** *is.* Qiraətlə, mütaliə ilə məşğul olan adam; oxucu.

**QİRAƏTXANA** *is.* [*ər.* qiraət və *fars.* ...xanə] Qiraətlə məşğul olmaq üçün yer (bina, zal, otaq və s.). *Klub qiraətxanası. Qiraətxana, axşam saat 5-dən açıqdır. Qiraətxana müdiri.*

**QİRAƏTXANAÇI** *is.* Qiraətxana müdiri, qiraətxana işçisi.

**QİSAS** *is.* [*ər.*] İntiqam; edilmiş pisliyin, düşmənçiliyin əvəzini çıxma, qanını yerdə qoymamaq. *Qisas almaq. – Bax, həmin bu otaqda od saçıb nəfəsindən; Atamın qisasını alacağam, – dedi, – mən.* S.Rüstəm. *Yurdumuzun qisasını yağılardan alarıq; Axıtdığı hər qan üçün ondan yüz qan alarıq.* R.Rza.

**QİSASÇI** *is.* Qisas almağa çalışan, intiqama can atan. *Məndən də nə zalım çıxar, oğlum, nə qisasçı; Bir dəfə bunu anla, ipəkdən qəzil olmaz.* Şəhriyar.

**QİSASÇILIQ** *is.* Qisasçının niyyəti, işi, hərəkəti, qisas almağa yönəldilmiş fəaliyyət. *Qisasçılıq siyasəti.*

**QİSİM** *is.* [*ər.*] 1. Bütöv bir şeyin ayrı-ayrı parçası; hissə. *Məhsulun bir qismi toplanmışdır. Mətnin bir qismi yığılmışdır. İşin çox qismi görülmüşdür. – Günlərimin bir qismini də Kərim baba ilə keçirirdim.* A.Şaiq. *Çocuqların bir qismi oynayır, bir qismi dənizdə çimirdi.* S.Hüseyn.

2. Növ, cür. [Şah:] *Aya sizin rəyinizə görə mən nə qisim tədbir ilə bu hadisəni öz vücudumdan dəf edə bilərəm?* M.F.Axundzadə. *Məlum şeydir ki, burada İsmayıl bəyin cavabı iki qisim ola bilərdi: ya hə, ya yox..* C.Məmmədquluzadə. *Bir qisim adamlar da Səttarzadənin müsamirəsinə iş üçün gələnlərdir.* Mir Cəlal.

**qisim-qisim** *sif.* [*ər.*] Cürbəcür, növbənöv, müxtəlif. *Yaqo .. Kassio Dezdemonanın mabeynində məhz ülfət və məhəbbət olduğunu qisim-qisim dəlillər ilə ərəbə sübut qılır.* F.Köçərli.

**QİSMƏN** *zərf* [*ər.*] Bir şeyin hamısı yox, bir hissəsi; tamamilə yox, bir qədəri; bir qədər. *Məsələ qismən həll edildi. Ay qismən tutulmuşdur. O, qismən haqlıdır. – Ənisə çox yaxşı bilirdi ki, ər evinə getməklə istər özünün, istər atası Məşədi Əhmədin maddi həyatı qismən yoluna düşə bilər.* S.Hüseyn.

**QİSMƏT** *is.* [*ər.*] 1. Tale, nəsib, qədər, bəxt; bəxtə çıxan şey. [Falçı qarı:] *Ay cavan, atdan düş, bir falına baxım. Sənin qismətində, deyəsən, bir gözəl var.* Çəmənzəminli. *Bizim qismətimiz göz yaşı deyil; Bizimdir yaşamaq, gülmək həvəsi.* S.Vurğun. // *məc.* Pay. *Bu günəşdən mənim niyə qismətim olmasın?* Mir Cəlal. *Biz qismətimizə düşən ağır yolu keçməsək, gələcək nəsillərimiz də o işığa tez gəlib qovuşmaz.* Ə.Məmmədxanlı. ☐ **Qismət olmaq** – bəxtinə çıxmaq, nəsib olmaq, payına düşmək, çatmaq. *Bəxtəvər başına sənin, ey rəqib; Xeyir sənə qismət oldu, şər mənə.* Q.Zakir. *Səndə bitər bir neçə vecsiz qoza; Ancaq o da qismət olar*

*donquza*. M.Ə.Sabir. [Hacı Həsən:] *Bir belə müqəddəs şəxs ilə qohum olmaq elə bir qənimətdi ki, dünyada az-az adama qismət ola bilər*. C.Məmmədquluzadə.

2. Parça, hissə. *Həmin hekayə iki qismətdən ibarətdir: biri o idi ki, mən indi nəql elədim*. C.Məmmədquluzadə.

3. *riyaz*. Bir ədədin başqa ədədə bölünməsindən alınan ədəd.

**QİSSƏ** *is*. [*ər*.] Rəvayət edilən doğru və ya uydurma hekayə, əhvalat; nağıl, hadisə, vaqiə, qəziyyə. *Sorma bu gecə silsileyi-zülfi-siyahın; Tulani olan qissədi bu, müxtəsər olmaz*. S.Ə.Şirvani. *Molla bu qissədən pərişanhal; Evinə döncək övrət etdi sual*.. M.Ə.Sabir. [Dəli Səməd] *..məzəli-məzəli qissələr nağıl eləyib eşidənləri də gülməyə vadar edirdi*. Çəmənzəminli.

**QİSVƏT** *is*. 1. Kobudluq, qabalıq.

2. Daşürəklik, zalımlıq.

**QİŞA** *is*. [*ər*.] *anat*. Canlı orqanizmin hər hansı bir hissəsinin üstünü örtən bəzi toxumaların adı; örtü, zar, pərdə, təbəqə. *Beyin qişası. Ağ ciyər qişası. Selikli qişa*.

**QİŞALI** *sif*. *anat*. Qişa ilə örtülmüş; pərdəli, örtülü.

**QİTƏ** *is*. [*ər*.] 1. *coğr*. Yer kürəsinin, okean və dənizlərlə əhatə olunmuş böyük hissələrindən hər biri. *Asiya qitəsi. Avropa başqa qitələrə nisbətən böyük deyildir. – Yer kürəsi günəşdən ayrılandan və üst təbəqəsi soyuyandan sonra ilk qitələr əmələ gəlmişdir*. M.Qaşqay. // Ölkə, məmləkət. *Nə yaxşı ki, insan əli yetmir Günəşə; Yetə bilsə, min qitəyə parçalayacaq*. M.Araz.

2. Parça, hissə, qisim, cüz. *Yeni əlifbanın iki qitədən ibarət olan surətini və habelə Tehran əmirlərindən birinə göndərdiyim məktubun surətini sizə göndərirəm*. M.F.Axundzadə.

3. *ədəb*. Azı iki beytdən ibarət və birinci beyti sonrakılarla həmqafiyə olmayan kiçik şeir.

**QİTƏLƏRARASI** *sif*. Yer kürəsinin qitələri arasında hərəkət edən, bir qitədən digər qitəyə, yaxud qitələrə gedib çatan. *Qitələrarası raket*.

**QİYABİ** *sif*. [*ər*.] 1. İşə münasibəti olan şəxsin özü olmadığı və iştirak etmədiyi halda baş verən, görülən. *Qiyabi mühakimə. Qiyabi hökm. Qiyabi tanışlıq. İşə qiyabi* (z.) *baxmaq*.

2. Mühazirələri müntəzəm dinləmədən, müəllimlə bilavasitə canlı əlaqədə olmadan, məktublaşma vasitəsilə təhsil alma üsulu ilə əlaqədar olan. *Qiyabi təhsil. Qiyabi pedaqoji institut*.

**QİYABİÇİ** *is*. və *sif*. Qiyabi təhsil alan (tələbə).

**QİYAFƏ** [*ər*.] b a x **qiyafət**. *Hələ içəridə qrim vurub, qiyafəsini dəyişdirib qapıdan çıxanda tanıya bilsən, qoçaqsan! – dedi*. A.Şaiq. *Sizin .. əlbisəniz və qiyafəniz elə təsir bağışlayırdı ki, mühitin ruhunu təhlil etmiş, onun məfkurəsini mənimsəmişsiniz*. S.Hüseyn. *İndi o* [Ulduz] *hərbi qiyafədə, serjant rütbəsində bir şəfqət bacısı idi*. Ə.Məmmədxanlı.

**QİYAFƏT** *is*. [*ər*.] Paltar, geyim, üst-baş. *Böyükxanım da Münəvvərin əlbisə və qiyafətini mülahizə edib dərin-dərin düşünürdü*. M.S.Ordubadi. // Bir adamın zahiri görünüşü, surəti; görkəm. [Bəhram:] *Əvvəl sən belə deyildin, mən səndən qaçırdım, amma indi başqa bir qiyafət almışsan*. C.Cabbarlı.

**QİYAQ** *is*. *bot*. Nazik şüy şəklində bitən yarpaqsız ot bitki. [Tarverdi] .. *yaşıl qiyağa qarışmış ala, qırmızı çiçəkləri yerə tökürdü*. S.Rəhimov. *Çayların üstündə əmələ gələn qara qiyaqların yalnız boynu burulur, çayırların kötüyü kəsilmirdi*. Ə.Vəliyev.

**QİYAM** *is*. [*ər*.] 1. Özbaşına, qeyri-mütəşəkkil üsyan, hakimiyyətə qarşı silahlı çıxış; bunt. *Atabəyin xəstə yatdığı şayiələri məmləkətə yayıldığı vaxt, bir çox evlərdə üsyan və qiyamlar başlayırdı*. M.S.Ordubadi. ☐ **Qiyam etmək** – üsyan qaldırmaq, üsyan etmək. *Qoy küçədə naz ilə xuram eyləsin oğlun! Öz xoşladığı əmrə qiyam eyləsin oğlun!* M.Ə.Sabir.

2. *klas*. Qalxma, ayaq üstə durma. // Birinə hörmət üçün ayağa qalxma. *Eylə sücud sidq ilə əbruyi-saqiyə; Ol sərvqamətin nəzərində qiyam bul*. Q.Zakir.

**QİYAMÇI** *is*. Qiyam edən, qiyamda iştirak edən adam; üsyançı. [Sədr:] *Müttəhim Baxşının qiyamçılar təşkilatlarına mənsub olması haqqında sizin əlinizdə başqa bir sübut varmı?* C.Cabbarlı.

**QİYAMÇILIQ** *is*. Qiyamda iştirak etmə, qiyam hərəkatı.

**QİYAMƏT** *is.* [*ər.*] 1. Dini etiqadlara görə axırzamanda aləm dağıldıqdan sonra bütün ölülərin dirilib qalxması; məhşər günü. *Güman etməyin ki, Şeyx Şəban azan verməyinə muzd alırdı; xeyr, əstəğfürullah, azan verməyi məhz savab əməl hesab edərdi və əcrini qiyamətdə Allahdan gözləyirdi.* Ə.Haqverdiyev.

2. *məc.* Müsibət, fəlakət, bəla, əzab, işgəncə mənasında. *Mənə bir munca qara-qorxu gəlmə ruzi-məhşərdən; Qiyamət varmı, ey vaiz, firaqi-yardən artıq?* M.V.Vidadi. *Hər günüm hicrində, ey məh, bir qiyamət tək keçər.* S.Ə.Şirvani.

3. *məc.* Gurultu, patıltı, səs-küy, mərəkə. *..Bunu görüb hər bir kəsdən soruşdumsa: – Bu nə qiyamətdir? – mənə cavab verən olmadı.* C.Məmmədquluzadə. *Lakin paltarları səhnəyə aparılmış arvadların qiyamətindən xəbərim yox imiş. Evə gələr-gəlməz üç yerdən üstümə düşüb ağızlarından çıxanı dedilər*. H.Sarabski.

4. *məc.* Çox gözəl, çox yaxşı, əla, görməli, eşitməli, çox maraqlı şey, hadisə, adam və s. haqqında. *Vəh nə qamət, nə qiyamət, bu nə şaxi-güli-tərdir.* Füzuli. *Sürmələnmiş siyah gözlər süzülür; Oturub-durmağı qiyamət olur*. M.P.Vaqif. *Yatana yaxın da bir kasa qatıq tapılsa, lap qiyamət olar*. M.İbrahimov. *Dostlar oturmuşdular. Gecəni qiyamət keçirirdilər.* Mir Cəlal. // Eyni mənada bəzən "qiyamətdir" şəklində işlənir. *Mən öz-özlüyümdə bu qədər ağıllı, bu qədər kamallı, bu qədər səliqəli Hacı görməmişəm, desəm, inanın, Hacı qiyamətdir, qiyamət!* Qantəmir.

5. *məc. dan.* Çoxluq, bolluq bildirir. *Bazarda qiyamət mal var. – Günün istisindən qar əriyib, qiyamət palçıq etmişdir.* N.Vəzirov.

◊ **Qiyamət eləmək (etmək)** – 1) çox böyük nailiyyət, müvəffəqiyyət əldə etmək, şöhrət qazanmaq, böyük fəaliyyət göstərərək hamının diqqətini özünə cəlb etmək. *Səni meydanda görən kimsə desin namxuda; Eyləyibdir genə aləmdə qiyamət, Hadi..* S.Ə.Şirvani; 2) son dərəcə gözəl, qəşəng şey haqqında. *Yüzün qiyamət eylər şol zülfü xal içində.* Nəsimi. *Səri-kuyin məhşər, qəddin qiyamət; Qiyamət edərsən saatbəsaət*. Q.Zakir. **Qiyamət qoparmaq** – 1) qışqırıq salmaq, haray qaldırmaq, vəlvələ salmaq, mərəkə salmaq, dava qaldırmaq. *Qıldı mən xəstəni məlamət; Başıma qopardı yüz qiyamət*. Xətayi; 2) şiddət etmək. *Hüsaməddinin ordusunu mühasirəyə almış Aran atlıları qiyamət qoparmışdı.* M.S.Ordubadi. *Külək yenə də qiyamət qoparırdı*. S.Rəhimov. **Qiyamət qopmaq** – çaxnaşma düşmək, səs-küy qalxmaq, vəlvələ düşmək, mərəkə qopmaq, aləm qarışmaq. *Qiyamət qopdu hüsnündən, yeddi iqlimə yayıldı*. Nəsimi. *Qiyamət qopsa, xublara; Aşiqindən zərər gəlməz*. Q.Zakir. *Qiyamət qopdu yahu, köhnə dünya tarü mar oldu*. M.Möcüz. **Qiyamətə qalmaq** – çox uzun və gəlib çatacağına az ümid olan, yaxud heç ümid olmayan vaxt haqqında. *Sirr sözüm yadlara aça bilmirəm; Qaldı qiyamətə dağ ürəyimdə.* Aşıq Ələsgər. *O zaman anladım itib əməyim; Qaldı bir də qiyamətə diləyim*. A.Səhhət. **Qiyamətə qədər, qiyamətəcən** – heç bir vaxt, heç bir zaman. [Qəmər:] *..Adam ki biriynən bir tikə çörək kəsdi, qiyamətəcən gərək onu unutmasın.* M.İbrahimov. **Qurdla qiyamətə qalmaq** *kin*. – b a x **qurd**[1].

**QİYAS** *is.* [*ər.*] 1. Məntiqdə: bir şeyi başqa bir şeyə bənzədərək və ya onunla müqayisə edərək hökm vermə, mühakimə yeritmə.

2. Zənn, güman, təxmin. [Molla Salman:] *Hacı Nuru, sənin qiyasına görə, mən gərək Qarun olaydım; bəs mən niyə bir həsir və lüləyindən qeyri bir zada malik deyiləm?* M.F.Axundzadə. ☐ **Qiyas etmək** – 1) müqayisə etmək, tutuşdurmaq, oxşatmaq; 2) zənn etmək, ehtimal etmək, hesab etmək. *Çünki şah çox cavan və göyçək oğlan idi.. Hərəmlər bu əmri zarafat kimi bir şey qiyas edirdilər..* M.F.Axundzadə. *Hükəma belə qiyas edir ki, bizim zəmanədə olan heyvanat və nəbatatın hamısı bir neçə cüft heyvan və ələfdən əmələ gəlmişdir*. H.Zərdabi.

**QİYƏ** *is.* [*ər.*] *köhn.* Üç girvənkəyə bərabər köhnə ölçü vahidi. *Biz bir qiyə buğdanı min hiylə ilə ələ keçirdiyimiz halda, onların payız və qış ərzaqları anbarda hazırdır.* M.S.Ordubadi.

**QİYMƏ** *is.* 1. Çox xırda döyülmüş ət. ☐ **Qiymə etmək** – qiymələmək, çox narın döymək. *Əti qiymə edib qızartmaq*.

2. Xırda döyülmüş ətdən hazırlanmış xörək.

◊ **(Ətini) qiymə çəkmək** *məc.* – tikə-tikə doğramaq. *Anacan, .. məni çəngələ asacaqlar, ətimi qiymə çəkəcəklər.* M.Rzaquluzadə.

**qiymə-qiymə** *zərf* Xırda-xırda, tikə-tikə. *Əti qiymə-qiymə doğramaq.* – [Ələmdar:] *Bu ikiağızlı qılıncımla onu qiymə-qiymə doğraram!* S.Rəhimov.

**QİYMƏBALIQ** *is. aşp.* İçinə yumurta, soğan və s.-dən hazırlanmış qiymə qoyulmuş balıq (xörək).

**QİYMƏÇIĞIRTMA** *is. aşp.* Soğan, istiot və zəfəran qarışdırılıb qovrulmuş və üzərinə yumurta vurulmuş qiyməli ət xörəyi.

**QİYMƏKEŞ** *is.* [qiymə və *fars.* ...keş] Əti narın döymək üçün kəsici alət, böyük ağır bıçaq.

**QİYMƏQOVURMA** *is.* Qiymə edilmiş ətdən, şabalıd və s.-dən bişirilən xörək; xuruş.

**QİYMƏLƏMƏ** "Qiymələmək"dən *f.is.*

**QİYMƏLƏMƏK** *f.* Qiymə etmək, narın döymək. *Əti qiymələmək.*

**QİYMƏLƏNMƏK** *məch.* Qiymə edilmək, narın döyülmək (ət və s.).

**QİYMƏLƏTDİRMƏK** b a x **qiymələtmək**.

**QİYMƏLƏTMƏ** "Qiymələtmək"dən *f.is.*

**QİYMƏLƏTMƏK** *icb.* Əti və s.-ni xırda-xırda doğratmaq, qiymə halına saldırmaq.

**QİYMƏLİ** *sif.* Xırda doğranmış ətdən hazırlanmış. *Qiyməli xörək.*

**QİYMƏLİK** *sif.* Qiyməyə yararlı, döyməyə yararlı. *Qiymələik ət.*

**QİYMƏPLOV** *is. aşp.* Xuruşu qiymə olan plov.

**QİYMƏŞABALID** *is. aşp.* Qiymə və şabalıddan hazırlanan yemək, ya xuruş.

**QİYMƏT** *is.* [*ər.*] 1. Bir şeyin (əmtəənin) pul vahidləri ilə ifadə olunan dəyəri. *Malın qiyməti. Bazar qiymətləri. Baha qiymət. Ucuz qiymət. Malların qiyməti aşağı salınmışdır.*

2. *məc.* Əhəmiyyət, dəyər, rol; etibar. *Bu sözlərin heç bir qiyməti yoxdur. O, mənim gözümdə bütün qiymətini itirmişdir. Bu şeyin bizim üçün qiyməti azdır. – Haqq sözə gərəkdi, düz qiymət olsun; Qiyməti verməyə mərifət olsun.* Aşıq Ələsgər. ◻ **Qiymətdən salmaq** – hörmətdən, etibardan salmaq, gözdən salmaq. [Şəmsiyyə] *..özünü qiymətdən sala biləcəyini, sərhəng Səfainin belə bir şərəfə layiq olmadığını kəsdirdi.* M.İbrahimov. // *məc.* Qədir-qiymət, dəyər. *Bilməz vəfanın qiymətin hər kim cəfayə tən edər*. Nəsimi.

3. Şagirdin, tələbənin bilik dərəcəsi haqqında verilən nömrə. *Orta qiymət. Pis qiymət. Dərslərindən əla qiymət almaq.*

◊ **Qiymət vermək (qoymaq)** – 1) bir şeyin dəyəri və keyfiyyəti haqqında fikir söyləmək, hökm vermək, qiymətləndirmək, dəyərləndirmək. – *Azərbaycanın qabaqcıl oğulları əsərə və tamaşaya yüksək qiymət vermişlər*. M.İbrahimov. *Sağlığında qiymət verin insanlara!* C.Novruz; 2) şagirdi, tələbəni və b. imtahan edərək bilik dərəcəsinə nömrə vermək; 3) b a x **qiymətləndirmək**. *Mənim rəncimə, yani zəhmətimə qiymət verərsən*. S.Rəhimov. *Damla zəhmətimə, zərrə şerimə; Sənsən qiymət verən dəryalar qədər.* B.Vahabzadə.

**QİYMƏTDAR** *sif.* [*ər.* qiymət və *fars.* ...dar] *köhn.* Qiymətli, dəyərli. *Nə qədər ki, məcmuəmizin adı söylənir, onun əziz və qiymətdar qələm yoldaşlarının qabaq sıralarında əziz yoldaşımız Əliqulu Qəmküsarın adı həmişə zindəbad alqışlarıyla zikr olunacaqdır.* C.Məmmədquluzadə.

**QİYMƏTLƏNDİRİLMƏ** "Qiymətləndirilmək"dən *f.is.*

**QİYMƏTLƏNDİRİLMƏK** *məch.* Qiymət verilmək, dəyərləndirilmək.

**QİYMƏTLƏNDİRMƏ** "Qiymətləndirmək"dən *f.is.*

**QİYMƏTLƏNDİRMƏK** *f.* 1. Bir adamın, şeyin və ya işin əhəmiyyətini, keyfiyyətini, dəyərini düzgün başa düşüb təqdir etmək, ona qiymət vermək; dəyərləndirmək. *İşçinin əməyini qiymətləndirmək. – Qəhrəman zəhmət vərdişini, əqli inkişaf, bədii zövqün tərbiyəsi ilə yanaşı təbiəti də qiymətləndirir.* S.Rəhimov.

2. Bir iş, hərəkət və s. haqqında fikir söyləmək; məna vermək. *Vəziyyəti düzgün qiymətləndirmək. Siz bunu necə qiymətləndirirsiniz? Onun hərəkətini lazımınca qiymətləndirmədiniz.*

**QİYMƏTLƏNMƏ** "Qiymətlənmək"dən *f.is.*

**QİYMƏTLƏNMƏK** *f.* Qiymətə, dəyərə malik olmaq; baha qiymətə getmək.

**QİYMƏTLİ** *sif.* 1. Qiyməti, dəyəri yüksək, baha olan; bahalı. *Qiymətli xalça. Qiymətli hədiyyə. Qiymətli şeylər. Almaz qiymətli daşdır. – ..Həmişə də qiymətli xam atı alıram ki, onu qoşquya öyrədim.* C.Məmmədquluzadə. *Hələ üstəlik, dəllək arvadının qiymətli boyunbağısı, qızıl suyuna çəkilmiş gümüş kəməri .. vardı.* S.Rəhimov. // Üzərində qiyməti yazılmış olan, dəyəri üzərində göstərilmiş, pul ilə ifadə olunan. *Qiymətli kağızlar. Qiymətli banderol.*

2. *məc.* Çox lazımlı, çox mühüm, çox dəyərli. *Qiymətli işçi. Arxivdən qiymətli sənədlər tapılmışdır. Qiymətli əsər. Qiymətli məlumat əldə etmək. – Budur, yanlarından keçdi bir nəfər; Qoltuğunda qalın, qiymətli cildlər.* M.Müşfiq.

3. *məc.* Üstün, yaxşı, xoş, əziz.

**QİYMƏTLİLİK** *is.* 1. Qiymətli, dəyərli olma, dəyərlilik.

2. Çox lazımlılıq, çox mühümlük.

**QİYMƏTSİZ** *sif.* 1. Heç bir qiyməti, dəyəri olmayan; dəyərsiz. *Qiymətsiz əşyalar.*

2. *məc.* Heç bir əhəmiyyəti olmayan. *Necə qiymətsiz imiş böyük eşqim, hünərim; Kim bilir ki, dürr ilə varlanmış bir ümmanam.* Şəhriyar.

**QİYMƏTSİZLƏŞDİRİLMƏ** "Qiymətsizləşdirilmək"dən *f.is.*

**QİYMƏTSİZLƏŞDİRİLMƏK** *məch.* Qiymətsiz hala salınmaq, dəyərsizləşdirilmək; qiymətdən salınmaq.

**QİYMƏTSİZLƏŞDİRMƏ** "Qiymətsizləşdirmək"dən *f.is.*

**QİYMƏTSİZLƏŞDİRMƏK** *f.* Qiymətdən salmaq, dəyərsizləşdirmək; qiymətini, dəyərini aşağı salmaq, qiymətsiz hala gətirmək, son dərəcə ucuzlaşdırmaq. *Xüsusi əmək qanununun olmaması fəhlələrin əməyini qiymətsizləşdirirdi.* M.İbrahimov.

**QİYMƏTSİZLİK** *is.* 1. Heç bir qiymətə, dəyərə malik olmama; qiymətsiz şeyin keyfiyyəti.

2. *məc.* Əhəmiyyətsizlik, dəyərsizlik.

**QİYMƏTŞÜNAS** *sif.* [*ər.* qiymət və *fars.* ...şünas] Qədir-qiymət anlayan, qiymət verə bilən, qiymətləndirə bilən.

**QİYYƏ** *məh.* bax **qıy**[1]. ☐ **Qiyyə çalmaq (çəkmək)** – bərk qışqırmaq, çığırmaq. *Bu halda qapı döyülür, evin sakitliyi pozulur. Kəbleyi .. qapını açmağa getdikdə, pişiyin əlini tapdalayır, pişik bərk qiyyə çalır.* H.Sarabski. *Hərdən şövqə gəlib çəkərlər qiyyə; Dərin üfüqlərdə əks edər qiyyə.* Şəhriyar.

**QLADİÁTOR** *is.* [*lat.*] Qədim Romada: sirklərdə bir-biri ilə və ya vəhşi heyvanlarla vuruşmaq üçün qullardan, əsirlərdən, yaxud məhkum edilmiş adamlardan hazırlanan pəhləvan. *Qladiatorlar boş-boş gəzən avara camaatı əyləndirib ona kef vermək üçün amfiteatr meydançasında bir-biri ilə və ya vəhşi heyvanlarla vuruşmağa məcbur edilən adamlar idi.* "Qədim dünya tarixi". *..Qışqırdı on bir min qladiator: – Silah! Silahsızlıq – hər şeyin sonu.* X.Rza.

**QLADİATORLUQ** *is.* Qladiatorun işi, peşəsi. *Bəzən varlı romalılar da öz qullarının bir hissəsini qladiatorluğa verirdilər.* "Qədim dünya tarixi".

**QLADİOLUS** *is.* [*lat.*] Süsənkimilər fəsiləsindən çoxillik bitki növü; qarğasoğanı.

**QLÁSNI** [*rus.*] *tar.* 1917-ci il inqilabından əvvəl Rusiyada: şəhər dumasının və ya başqa seçkili idarənin üzvü. *Budur, bax, uprava məlum edir ki, təzədən dörd illik dumaya qlasnı seçmək siyahısı bu iyun ayının 27-dən elan ediləcəkdir.* N.Vəzirov.

**QLAUKÓMA** [*yun.*] *tib.* Göz mayesi təzyiqinin artması şəklində təzahür edən ağır göz xəstəliyi.

**QLAVÁ** [*rus.*] *tar.* 1917-ci il inqilabından qabaq: şəhər idarəsi rəisi, bələdiyyə idarəsi başçısı. *Əvvəl, yəni iki il bundan əqdəm Xudayar bəy qlava yanında çavuş idi.* C.Məmmədquluzadə.

**QLİSERÍN** [*yun.*] Yağlardan hasil edilən, texnikada, ətriyyat istehsalında və s.-də işlədilən dadı şirintəhər qatı maye; ən sadə üçatomlu spirt.

**QLİSSÁNDO** [*ital.*] *mus.* Barmaqları fortepianonun dilləri, arfa, yaxud skripka kimi alətlərin simləri üzərindən yüngülcə və cəld sürüşdürməkdən ibarət çalma üsulu.

**QLÍSSER** [*fr.*] Yastıdibli, itigedən qayıq.

**QLOBAL** [*lat.*] Bütün Yer kürəsini bürüyə bilən. *Qlobal hadisələr.*

**QLÓBUS** [*lat.*] Adətən öz oxu ətrafında fırlanan Yer kürəsinin modeli. *Saçlarını geriyə daramış, uzunbığlı, ucaboylu müəllim əlində*

*qlobus qapı ağzında göründü*. M.Hüseyn. ..*Qoca bir müəllim gəldi; o, əlində tutduğu qlobusda dünyanın dənizlərini, çaylarını, dağlarını və dərələrini göstərirdi*. M.Arif.

**QLÜKÓZA** *is*. [*yun*.] Üzüm şəkəri. "*Qlükoza*" *adı yunanca* "*qlükos*" *sözündən gəlir ki, bu da* "*şirin*" *deməkdir və maddənin şirin dadı olduğunu göstərir*. "Kimya".

**QNEYS** *is*. [*alm*.] Qədim metaforik süxur.

**QNOSEOLÓGİYA** [*yun*.] *fəls*. İdrak nəzəriyyəsi; fəlsəfənin, idrakın mənbələrindən, imkanlarından və vasitələrindən bəhs edən şöbəsi.

**QNOSEOLOJÍ** *sif. fəls*. Qnoseologiyaya, idrak nəzəriyyəsinə aid olan. *Qnoseoloji görüşlər*.

**QOBELEN** *is*. [*fr*.] Əllə toxunmuş şəkilli divar xalçası.

**QOBÓY** *is*. [*fr*.] Nəfəsli musiqi aləti.

**QOBU** *is*. 1. Sel və ya çay sularının uzun müddət axması və ya zəlzələ nəticəsində əmələ gələn çuxur, çuxur yer, kiçik dərə. *Qarabağ düzü çökəkliklər və qobularla zəngindir*. – *İçərilərə doğru yeyinlədi, ağaclıqlar dalında köhnə qobu var idi*. Mir Cəlal.

2. Çayın dərin yeri.

3. Düzən, düzənlik.

**QOBUR** *is*. Dəridən, ağacdan və s.-dən düzəldilmiş tapança və ya tüfəng qabı. *Elmar .. tapança qoburunu tapdı*. İ.Əfəndiyev. *Tapançanı ehmalca qoburundan çıxarıb sağ əlimə aldım və ehmalca ayaqda saxladım*. Ə.Vəliyev.

**QOBURLU** *sif*. Qoburu olan, qobura qoyulmuş, qobur içində olan. *Ələmdar beşaçılan tüfəngini, taxta qoburlu mauzerini, patrondaşlarını götürüb yaraqlandı*. S.Rəhimov. [Həmidin] *böyründən qayışı bozarmış, köhnə qoburlu tapança sallanırdı*. M.Hüseyn.

**QOBUSTAN** *is*. [qobu və *fars*. ...stan] Qobuluq, düzənlik.

**QOBUZ** bax **qopuz**.

**QOCA** 1. *sif*. Yaşlı, qocalmış (*cavan* ziddi). *Qoca kişi. Qoca kəndli. Qoca alim. Qoca at*. – *Bahadır hələ üzünü yumamış, ev yiyəsi qoca arvad Bahadırı çay içməyə çağırdı*. N.Nərimanov. *Bu anda qoca usta başını dik qaldırıb, dəmir qüllənin zirvəsində durmuş fəhləni səslədi*. M.Hüseyn.

2. *is*. Qocalmış, yaşı ötmüş, qocalıq yaşına çatmış kişi. *Qocalara hörmət. Qocalar və cavanlar*. – *Qocanın biliyi, cavanın biləyi*. (Ata. sözü). *Qoca hələ sözünü tamamlamamışdı ki, birdən təbil-davul vuruldu*. "Koroğlu". *Kərim baba qısaboylu, geniş kökslü bir qoca idi*. A.Şaiq. // Evin ən yaşlı, ən böyük, təcrübəli üzvü, ağsaqqalı. *Qoca evin sütunudur*. (Ata. sözü).

3. *sif. məc*. Qədim, köhnə. *Qoca dünya*. – *Qoy məndən dərs alsın qoca təbiət; O da könlüm kimi gülsün həmişə*. S.Vurğun. *Lakin qoca tarix bilir bu yerlərin yaşını*. R.Rza.

4. *is*. Kişi, ər. [Xanpəri:] *Onun cadusunda mən bir hikmət görmüşəm ki, əgər istəsə bu saatda məni qocamdan boşadar*. M.F.Axundzadə.

**QOCAFƏNDİ** *sif*. Qoca üçün əlverişli, qocaya yaraşan, qocaya münasib olan.

**QOCALAŞDIRMA** "Qocalaşdırmaq"dan *f.is*.

**QOCALAŞDIRMAQ** *f*. Qoca göstərmək. *Bu paltar onu lap qocalaşdırır*.

**QOCALAŞMA** "Qocalaşmaq"dan *f.is*.

**QOCALAŞMAQ** *f*. Yavaş-yavaş qocalmaq, qocalıq yaşına dolmaq.

**QOCALIQ** *is*. 1. Qoca adamın, heyvanın və ya ağacın halı. *Ay ağalar, tutdu qoldan; Bixəbər birdən qocalıq*. Molla Cümə. *Atalar oğul istər ki, qocalıqda söykənəcəkləri olsun*. Mir Cəlal.

2. Qədimlik, köhnəlik.

◊ **Qocalıqda yorğalıq** – yaşlı adama yaraşmayan hərəkət haqqında. [Hacı Murad:] *Ay sağ olmuş, mənim ömrüm keçmişdir, qocalıqda nə yorğalıq?* S.S.Axundov.

**QOCALI-CAVANLI** *top*. Qocalar və cavanlar hamısı. *Qocalı-cavanlı hamısı təzə paltar geyinmişdi*. Ə.Vəliyev.

**QOCALMA** "Qocalmaq"dan *f.is*.

**QOCALMAQ** *f*. 1. Qoca olmaq, qocalıq yaşına dolmaq. *O çox tez qocaldı*. – *Cavanlar gəldi dünyayə, qocaldım, heyf, pir oldum*. S.Ə.Şirvani. *Əfsus qocaldım, ağacım düşdü əlimdən; Səd heyf, cavanlıq!* M.Ə.Sabir.

2. *məc*. Köhnəlmək, gücdən düşmək, yıpranmaq. *Köhnə dünya qocalır, bu döyüşdə qartalır*. R.Rza.

**QOCALMIŞ** *f.sif*. 1. Qoca yaşına çatmış; qoca. *Qocalmış kişi. Qocalmış şair*.

2. Köhnəlmiş, gücdən düşmüş, yıpranmış. *Qocalmış çinar. Qocalmış torpaq.*

**QOCALTMA** "Qocaltmaq"dan *f.is.*

**QOCALTMAQ** 1. *icb.* Vaxtından tez qocalmasına səbəb olmaq. *Dərd onu qocaltdı.*

2. *f.* Qoca kimi göstərmək, qoca göstərmək. *Sən özünü lap qocaltdın. Bu paltar onu qocaldır.*

**QOCAMAN** *sif.* 1. Yaşlı, çox yaşayıb yaratmış, təcrübə qazanmış; uzunmüddətli xidmət və fəaliyyətinə görə hamının hörmətini qazanmış; əməkdar. *Qocaman alim. Qocaman ədib. Qocaman artist. – Qoca ayrı, qocaman ayrı.* (Ata. sözü). *Qocaman sənət xadimini dinləməyi arzu edən çox idi.* Mir Cəlal. // Qoca, yaşa dolmuş. *Bu gün neçə gündür qocaman Zakir; Tazə-təri sevmiş, tazə-tər olmuş.* Q.Zakir.

2. *məc.* Əzəmətli, iri, böyük, cəsamətli. *Qocaman dağlarda qucaqlaşmış olan bu gözəl kənd bahar zamanı hər tərəfdən çiçəkli, geniş və sərin qanadları altına bir çox müsafir alırdı.* A.Şaiq. *Geniş və qocaman meşənin ən yaxşı vaxtı idi. Hər tərəfə ətir səpilmişdi.* Mir Cəlal. *Onlar yerli-yataqlı, şax-budaqlı qocaman bir çinarın dibində doyunca yeyib, al şərabdan içmiş, yatıb xumarlanırdılar.* M.Rzaquluzadə.

**QOCAYANA** b a x **qocafəndi**.

**QOÇ** *is.* 1. Qoyunun erkəyi, damazlıq erkək qoyun. *Qoç döyüşünə qoç dayanar.* (Ata. sözü). □ **Qoç döyüşdürmək** – keçmişdə: əyləncə üçün xüsusi təlim verilmiş qoçları bir-biri ilə kəllə-kəlləyə vuruşdurmaq adəti. [Allahqulu:] *O məndən bir-iki saat irəli gəlibdir, odur həyətdə qoç döyüşdürür.* N.Vəzirov.

2. *məc.* İgid, qoçaq. *Qoç Koroğlu gələr qoşa; Polad qalxan tutar başa.* "Koroğlu". *..Tez ol, yüyür, qoçum! Daha yubanma, o vaxt deyil, .. məni qurtar.* M.S.Ordubadi. *Durma, haydı, carçı göndər, qoç ərləri topla, yağı üstünə axın var, axın!* M.Rzaquluzadə.

**QOÇAQ** *sif.* İgid, şücaətli, rəşadətli, qorxmaz; mərd. [Heydər bəy:] *..Handa bir rəşid və qoçaq adam cürət edib bir yük, iki yük çıxarda bilər.* M.F.Axundzadə. *Məgər bu şəhərdə hamıdan qoçaq mən oldum?* C.Məmmədquluzadə. // Zirək, bacarıqlı, dilavər. [Ahıl qadın:] *..Cahan hər işi düzəldir, qoçaq arvaddır.* Ə.Haqverdiyev. // İs. mənasında. *Zülməti-şəbdə qızarır dan yeri; Haydı, qoçaq, haydı igid, qoş, yeri!* A.Səhhət. *Vətən oğlu, el qoçağı Bəxtiyar! Sənə ölməz igid desəm, yeri var.* R.Rza. // Nida yerində. *Ay qoçaq! Ay qoçağım!* – [Ağa Kərim xan:] *Bərəkallah, qoçağım Rəhim, afərin!* N.Vəzirov.

**QOÇAQCASINA** *zərf* Qoçağa layiq bir surətdə, igidliklə, mərdliklə. *Qoçaqcasına hərəkət.*

**QOÇAQLANMAQ** b a x **qoçaqlaşmaq**.

**QOÇAQLAŞMA** "Qoçaqlaşmaq"dan *f.is.*

**QOÇAQLAŞMAQ** *f.* Qoçaq olmaq, igidləşmək, cəsurlaşmaq, ürəklənmək. // Zirəkləşmək.

**QOÇAQLIQ** *is.* İgidlik, rəşadət, şücaət, mərdlik. *Qoçaqlıq göstərmək.* – [Tarverdi:] *A qardaş, bircə qulaq as, gör nə deyirəm, sən qoçaqlığı lap qələt anlayırsan.* M.F.Axundzadə. // Zirəklik, hünərlilik, hünər. [Cahanın] *qoçaqlığını ondan bil ki, bu yaşında üç-dörd ayın içində savadlandı.* Ə.Haqverdiyev.

**QOÇBAŞI** *is. tar.* Qədim müharibələrdə: qalaların divarlarını dəlmək üçün bir tərəfinə qoyun başı kimi dəmir taxılmış tirdən ibarət hərb aləti. *Gecə-gündüz divarları qoçbaşı adlanan alətlərlə dağıdırdılar.*

**QOÇBAZ** *is.* [qoç və *fars.* ...baz] Köhnə məişətdə: döyüşdürmək üçün qoç saxlayan və bu işlə məşğul olan adam.

**QOÇBAZLIQ** *is.* Köhnə məişətdə: döyüşdürmək üçün qoç saxlama və qoç döyüşdürmə. *Mollaxanadan qovulan gündən etibarən uşaq fikrini quşbazlıq, qoçbazlıq .. və bu kimi işlərə verərdi.* H.Sarabski.

**QOÇBUYNUZU** *sif.* və *zərf* Qoçbuynuzu kimi buruq. [Zöhrə] .. *birçəklərini qoçbuynuzu burdu, sonra balaca darağı ilə telini darayıb, birçəklərinin arasında qırçınladı.* Ə.Vəliyev.

**QOÇLUQ** *is. dan.* İgidlik, qoçaqlıq, ürəklilik, diribaşlıq, zirəklik, dilavərlik.

**QOÇU** *is. köhn.* Keçmişdə: xalqa əziyyət verən, camaatı qorxu altında saxlayan, tədhiş edən, qan tökməkdən çəkinməyən, özbaşınalıq edən adam; qolugüclü. *Qoçular, quldurlar qatar taxardı; Fağır-füqəraya yan-yan baxırlar.* Aşıq Ələsgər. *Yerli neft bur-*

*juaziyasının mənfəətini müdafiə üçün yüzlərcə maaş alan qoçular vardı.* M.S.Ordubadi. *Bakı qoçuları bütün şəhərdə özbaşınalıq edirdilər*. A.Şaiq.

**QOÇUBAZLIQ** *is. köhn*. Keçmişdə: varlıların qoçu saxlaması, qoçulara arxalanması. // Qoçuluq etmə, qoçuluqla məşğul olma; xalqı tədhiş edib əziyyət vermə; qoçuların başlı-başınalığı. // Dəstəbazlıq, zorakılıq, qolugüclülük. *Çar rejiminin zəhərli meyvələrindən biri də qoçubazlıqdır.* A.Şaiq. *O zamanlar Bakıda və Bakının ətraf kəndlərində tapançabazlıq, qoçubazlıq mod olmuşdu*. H.Sarabski.

**QOÇULUQ** *is. köhn*. Qolçomaqlıq, qolugüclülük, zorakılıq. // Qoçuların başlı-başınalığı. *Doğrudan da, mədənlərdə oğurluq, qoçuluq gündən-günə artırdı.* A.Şaiq.

**QODUQ** *is.* Eşşəyin balası (bəzən söyüş yerində işlənir). *Qoduq hürkəndə anasından qabaq düşər*. (Ata. sözü).

**QODUQLAMA** "Qoduqlamaq"dan *f.is.*

**QODUQLAMAQ** *f.* Bala doğmaq, balalamaq (eşşək haqqında).

**QODUQLANMA** *dan*. "Qoduqlanmaq"dan *f.is.*

**QODUQLANMAQ** *f. dan.* Birinin qabağında kiçilmək, alçalmaq, yaltaqlanmaq.

**QODUQLUQ** *is. dan.* Dustaqxanaya zarafatla verilən ad. *Qumru kənd soveti milisini çağırıb,* .. [Xuduşu] *qoduqluğa saldırdı.* Ə.Əbülhəsən. *Bunların hamısını bu saat apar, yığ qoduqluğa! Sonra bircə-bircə özümüz ayırd edərik.* S.Rəhimov.

**QODU-QODU** *is. etnoqr*. Keçmişdə: arasıkəsilmədən yağış yağdıqda kənd uşaqlarının toplaşıb həyət-həyət gəzərək nəğmə oxuma mərasimi və bu mərasimdə oxunan nəğmənin özü.

**QOĞAL** *is.* Kiçik, yağlı və ya yağsız, südlü girdə çörək; kökə. *Yağlı qoğal. – Mehmanlara hazır elə min dürlü naharı; Ver küncə qoğalı.* M.Ə.Sabir.

**QOHUM** *is.* 1. Biri ilə qohumluq əlaqəsi olan adam. *Yaxın qohum. Uzaq qohum. Ata tərəfindən qohum. – Hazırda mən öz qohumlarım və öz elim ilə bərabər cəbhəyə gedirəm*. M.S.Ordubadi. *Məlum oldu ki, Mirzə Səfərin, Həsən ağanın qohumu ilə rəftarı ağanın qulağına çatıb.* Ə.Haqverdiyev.

2. Mənşə etibarı ilə bir-birinə yaxın. *Bu çiçəklər bir-birinə qohum olub, bir fəsiləyə mənsubdur. Qohum dillər. – Darvin öz kitabında yazır: "Heyvanlar bir-birinə qohumdurlar*." C.Məmmədquluzadə.

**QOHUMBAZ** *is.* [qohum və *fars*. ...baz] Öz qohumlarını həddindən artıq sevən adam; öz qohum və yaxın adamlarının mənafeyini ictimai mənafedən yüksək tutan, yalnız onların mənafeyini güdən adam. // Tərəfsaxlayan, üzgörən adam.

**QOHUMBAZLIQ** *is.* Öz qohum-qardaşını həddən artıq sevmə; yalnız öz qohumlarının yaxın adamlarının mənafeyini güdmə, birinci növbədə onların xeyrini nəzərdə tutma. *Kiminin rüşvətxorluğu, qohumbazlığı; kiminin xəsisliyi, bəzisinin nadanlığı tənqid olunurdu.* Mir Cəlal. // Tərəf saxlama, üz görmə. *Qohumbazlıqla mübarizə. – ..Kənardan baxan elə biləcək ki, qohumbazlıq eləyirəm.* M.Hüseyn.

**QOHUMCANLI** *sif.* Öz qohumlarını, öz yaxın adamlarını çox sevən, onların qeydinə qalan. *Qohumcanlı adam.*

**QOHUMCANLILIQ** *is.* Öz qohumlarını, öz yaxın adamlarını çox sevmə, onların qeydinə qalma.

**QOHUM-ƏQRƏBA** *top*. [qohum və *ər*. əqrəba] Qohumlar. [Xortdan:] *Qohum-əqrəba yığılıb onu evdən qovdular, qaldı küçədə.* Ə.Haqverdiyev. [Həcər xanım:] *Piri baba, Çingizin burada olmasının xatası yoxdur, Şahbaz bəyin qohum-əqrəbası dinc durmayacaqdır.* S.S.Axundov. *..Bilirəm, arvadın qohum-əqrəbası başına yığılıb necə dartışdıracaqlar.* Mir Cəlal.

**QOHUM-QARDAŞ** *top*. Qohumlar, əqrəba. *Kimim vardır qohum-qardaş el olsun; Qərib öldüm, bikəs öldüm, yad öldüm.* M.V.Vidadi. *Bütün qohum-qardaş başına toplanmış olduğu halda*, .. [Günəşin] *qəlbi açılmır, üzü gülmürdü.* A.Şaiq. *Cümə günü gecə Hacı Abtalıb qohum-qardaşını başına cəm eləyib, xəlfə Hacı Haşımı çağırıb, aynanı onun əlinə verir və xonça əllərində yola düşürlər*. H.Sarabski.

**QOHUM-QONŞU** b a x **qonum-qonşu**. *Mirzə Kələntəri həyətdə görməyən qohum-*

*qonşu təəccüblə ondan soruşdular*. S.Rəhimov. *Qohum-qonşu qadınlarla görüşmək Büləndi çox yormuşdu*. Ə.Əbülhəsən.

**QOHUM-QUDA** b a x **qohum** 1-ci mənada. *Hacı Abtalıb istəyir səninlə qohum-quda olsun*. H.Sarabski.

**QOHUMLAŞDIRMA** "Qohumlaşdırmaq"-dan *f.is.*

**QOHUMLAŞDIRMAQ** *f.* Qohum etmək, yaxınlaşdırmaq.

**QOHUMLAŞMA** "Qohumlaşmaq"dan *f.is.*

**QOHUMLAŞMAQ** *f.* 1. Əslində qohum olmayıb, sonradan bir-birinə qız verib almaqla qohum olmaq. [Məhərrəm bəy:] *Mən özümü çox xoşbəxt hesab edərdim ki, sənin ilə qohumlaşmaq mümkün olaydı*. S.S.Axundov.

2. *məc.* Yaxınlaşmaq, dostlaşmaq.

**QOHUMLU** *sif.* Qohumları olan. *Yarı az sevirəm qohum-qardaşdan; Qohumlu bəxtəvər, gözüm yoldadır*. Ə.Cavad.

**QOHUMLUQ** *is.* 1. Ən yaxın əcdad ümumiliyi əsasında insanlar arasında əmələ gələn münasibət; əqrəbalıq. *Yaxın qohumluq. Uzaq qohumluq. – Üç-dörd gün bundan qabaq qəssab Cəmil gəldi bizə. Bununla bizim bir yüngülvari qohumluğumuz da varmış*. C.Məmmədquluzadə. *Heç onun bizə qohumluğu da çatmır. Bununla belə, uşaqlıqdan bəri biz ona "Sarı bibi" demişik*. Qantəmir. // Evlənmə nəticəsində əmələ gələn münasibət.

2. Mənşə ümumiliyi və ya bilavasitə bənzərlik cəhətdən yaxınlıq. *Dillərin qohumluğu. Qohumluq və mənşə etibarı ilə bir-birinə yaxın və uzaq olan bitkilərin çarpazlaşdırılması nəticəsində yeni bitki növləri alınır*.

**QOHUMPƏRƏST** [qohum və *fars*. ...pərəst] b a x **qohumbaz**.

**QOHUMPƏRƏSTLİK** b a x **qohumbazlıq**.

**QOXARCA** *is. zool.* Qiymətli dərisi (xəzi) olan bir heyvan.

**QOXMAQ** b a x **qoxumaq**. *Alnını aydınlıq öpərək oxşar; Gül-çiçək qoxar gül yanağın sənin!* A.Şaiq. *Çiçəklər, otlar, güllər bahar günəşinin ılıq şüası altında ruhlanıb, təravətlənib gözəl qoxurdular*. Çəmənzəminli.

**QOXU** *is.* Maddələrin buruna təsir etmə xassəsi, burunla hiss olunan şey; iy. *Tənbəki qoxusu. Çiçəklərin gözəl qoxusu. Pis qoxu. Tünd qoxu. Kəskin qoxu. – Səba saçın qoxusundan müəttər olmuşdur*. Nəsimi. *Meşədən həmişəki ürəkaçan, ətirli rayihə əvəzinə rütubətli çürüntü qoxusu gəlirdi*. M.Rzaquluzadə. *Surxay otaqdakı tünd qoxudan burnunun qıcıqlandığını hiss etdi*. İ.Əfəndiyev.

**QOXULAMA** "Qoxulamaq"dan *f.is.*

**QOXULAMAQ** *f.* 1. Burunla nəfəs çəkərək, bir şeyin iyini almaq, iyini duymağa çalışmaq. *Gülü qoxulamaq*.

2. *məc.* Yoxlamaq, öyrənməyə, tanımağa, bilməyə çalışmaq. *Qorodovoylar, jandarmalar yenə də öz duracaqlarında gəzişir və gəlib-gedənləri it kimi qoxulayırdılar*. M.S.Ordubadi.

**QOXULANDIRMAQ** b a x **qoxutmaq**.

**QOXULANMA** "Qoxulanmaq"dan *f.is.*

**QOXULANMAQ** *f.* İylənmək, iy vermək.

**QOXULU** *sif.* Müəyyən iyi olan. *Bənövşə qoxulu yardan ayrılan; Gündə yasa batar, günü zar olar*. M.P.Vaqif.

**QOXUMA** "Qoxumaq"dan *f.is.*

**QOXUMAQ** *f.* 1. Müəyyən iy vermək. *Bu yerlərdə müşkü ənbər qoxuyur; Nazlı dilbər gəzən yerdir bu yerlər*. Aşıq Kərəm. *Səhərlər Muğan çöllərinin nəfəsi ətir qoxuyur*. M.İbrahimov.

2. Pis iy vermək, üfunətlənmək, iylənmək, çürümək. *Havalar istiləşdikcə fabrikin havası xarablaşır, çirkab suları küçələrə çıxır, qoxuyur. Bu rütubət və üfunət qoxusu oradan gəlirdi*. M.Rzaquluzadə.

3. *məc.* Bir şeyin əlamətini, işarəsini, nişanəsini göstərmək mənasında. *Sərin bir iyun axşamı idi, lakin bu sərinlik yaz qoxumurdu*. Ə.Əbülhəsən.

**QOXUMUŞ** *sif.* İylənmiş, üfunətli. *Qoxumuş pendir. Qoxumuş meyvə. – Yolun üstündə qoxumuş bir köpək cəmdəyi düşmüşdü*. M.S.Ordubadi.

**QOXUSUZ** *sif.* Heç bir qoxusu olmayan, heç bir iy verməyən. *Qoxusuz çiçək. Dadsız və qoxusuz meyvə. Qoxusuz dərman*.

**QOXUTMA** "Qoxutmaq"dan *f.is.*

**QOXUTMAQ** 1. *t-li*. Bir şeyi çox saxlayıb iyləndirmək, köhnəltmək, çürütmək.

2. *t-siz*. Qoxu vermək, iy yaymaq, üfunətlənmək.

**QOL[1]** *is.* 1. İnsan bədəninin, çiynin başından barmaqların ucuna qədər olan iki üzvündən hər biri. *Sağ, sol qol. Qolunu qaldırmaq. – İzzət Əhmədin qolundan yapışıb gətirib oturtdu palaz üstə ki, oğlan rahatlansın.* C.Məmmədquluzadə. [Telli] *sol biləyini gözlərinin üstünə qoymuş, bütün qolu açıqda qalmışdı.* S.Hüseyn.

2. Atın qabaq ayaqlarından hər biri. *Atın sağ qolu axsayır.*

3. Paltarın qolu örtən hissəsi. *Pencəyin bir qolu uzundur.* – [Gülbadam] *ağ kiseyi köynəyinin enli qolları ilə uşağın alnındakı təri sildi..* N.Nərimanov. *Məşədi Həsən çuxasının qolları əlində oynamağa başladı.* Çəmənzəminli.

4. Ağac budağı, şaxə. *Ağacın qolları çox genişdir.* ◻ **Qol atmaq** – şaxələnmək, qol-budaq atmaq, hər tərəfə yayılmaq. *Yenə səssiz, cansız yurdlar qol atmışdı hər yana; Alaçıqlar muncuq kimi düzülmüşdü yan-yana.* A.Şaiq.

5. Əsas bir şeydən, ana xətdən ayrılan şöbə, hissə, qisim, xətt. *Dəmiryol stansiyasından mədənə bir qol ayrılır. – Hansı çay ki gedib dəryaya tökülür, ona böyük çay və ya nəhr; hansılar ki, böyük çaya tökülür, onlara qol deyilir.* H.Zərdabi. *Kür Xəzərə yaxınlaşdıqca və ona yeni qollar bitişdikcə bu çayın suyu artır.* M.Qaşqay. [Gülpəri:] *Kəhrizdən qol ayırıb aparıb pambığını suvarıb.* Ə.Haqverdiyev. *Dağın ətəyindən ayrılır bir qol; Tikanlı kəndinə ayırır bu yol.* S.Vurğun. // Dastanın ayrı-ayrı hissəsi, fəsli, hekayəsi, epizodu. [Əmiraslan] *özü də dönüb oğluna "Koroğlu" dastanının ayrı-ayrı qollarını nağıl edər*(*di*). S.Rəhimov. // Bir ordunun və s.-nin ayrıldığı hissələrdən hər biri. *Çar ordusu üç qola ayrılmışdı. Onların bir qolu Şahzadə bağına qapanmış*(*dı*).. M.S.Ordubadi. *Dəstəmiz qollara ayrılmalı, hərəkət təlimi verilməli idi.* Mir Cəlal.

6. Cinah, tərəf, səmt. *Sağ qol. Sol qol. – Sağ qoldan isə öz vurulmuş tanklarının ardınca qalxan bu piyada Muxtarov, Dadaşın qəfil və sərrast atəşi altına düşdü.* Ə.Əbülhəsən.

7. İmza. [Süleyman:] *Necə etməz, bəs bu boyda peçatı, bu yoğunluqda qolu görmürsən?* M.İbrahimov. [Gəldiyev] *inanmışdı ki, qulluq işində adamı yıxan, dikən sədrin, müdirin, naçalnikin bir qırmızı qoludur.* Mir Cəlal. ◻ **Qol qoymaq, qol çəkmək** – 1) imzalamaq, imza etmək. *Bir yerdə .. ərizə yazırlar və cəm olan on beş nəfər haman ərizəyə qol qoyurlar.* Ə.Haqverdiyev. *Qol çəkməyi bilirəm, amma sənin kimi oxumuş deyiləm.* Qantəmir; 2) *məc.* tamamilə razılaşmaq, qəbul etmək. *Elə mən də sən deyənə qol qoyuram.* M.Hüseyn.

8. *xüs.* Bəzi alətlərdə və mexanizmlərdə hərəkəti nizama salan və başqa vəzifələr görən qola oxşar hissə.

◊ **Qol zoruna** – zorakılıqla, güclə, zorla, zor işlədərək. *Burada qol zoruna iş keçməz.* **Qolları arasına almaq –** qucaqlamaq. *Həsən* .. [Dilaranı] *qolları arasına alıb dodaqlarından öpdü.* M.İbrahimov. **Qollarını açmaq** – birini qucaqlamağa hazırlanmaq, məmnuniyyətlə, gülər üzlə qarşılamaq. **Qollarını atmaq** – b a x **qollarını ölçmək**. *Baba qollarını ata-ata* (z.) *yenə danışmaq istədi, lakin öskürək onu boğdu.* Çəmənzəminli. **Qollarını .. boynuna dolamaq (sarımaq)** – birini bərk-bərk qucaqlamaq. *Süsən atasına yanaşdı, dirsəyəcən çırmanmış qollarını onun boynuna doladı.* M.Hüseyn. **Qollarını ölçmək** – danışarkən qolları ilə hərəkət etmək, qollarını oynatmaq. *Şah ayaqlarını taxtdan sallayıb, qollarını ölçərək cır səsi ilə çığırdı.* Çəmənzəminli. **Qoluna girmək** – 1) qolunu birinin qoluna keçirmək. *O, dostunun qoluna girib balkona çıxartdı.* Ə.Vəliyev; 2) qolunu gəzə bilməyən xəstə və ya başqa adamın qoluna keçirərək, ayağa qaldırıb gəzdirmək. **Qolundan qaldırmaq** – b a x **qolundan tutmaq**. *Bir də onlar məni qolumdan qaldırdılar. Yoldaşlıq naminə ailəmə kömək verdilər.* M.Hüseyn. **Qolundan tutmaq** – kömək etmək, əl tutmaq, yardım göstərmək. [İsmayıl:] *Onun qədim nökəri Cavad bir az onun qolundan tutur.* Ə.Haqverdiyev. **Qolundan yapışmaq** – b a x **qolundan tutmaq**. [Tubu:] *Qızını bir eləsinə ver ki, lazım olan vaxt qolundan yapışsın.* Ə.Haqverdiyev. *Kişiyə ürək-dirək verdik, qolundan yapışdıq, evimizə gətirib, neçə gün, neçə gecə qonaq saxladıq.* S.Rəhimov.

**QOL²** [*ing.*] *idm.* 1. *köhn.* Futbol, xokkey, su polosu və s. oyunlarda oyunçuların topu vurub keçirdikləri qapı, yaxud ayrılmış yer. *Birdən oğlan qışqırır: "Dinamo" qol vuracaq!* M.Rahim.

2. Bir komandanın, topu rəqibinin qapısından keçirdikdən sonra qazandığı xal, say. ◊ **Qol vurmaq** – müqabil tərəfin qapısından topu keçirmək.

**QOLAC** *is.* Qolları hər iki tərəfə açdıqda bir əlin barmaqları ucundan o biri əlin barmaqları ucuna qədər olan məsafə, ara (xalq arasında saylarla birlikdə uzunluq ölçüsü kimi işlənir). *İpin uzunluğu beş qolacdır. – Siyah zülfü dal gərdəndə bir qolac; Sona cıqqası tək ucları qıyqac.* Q.Zakir. *Ucu əşrəfili bulud kimi saç; Dal gərdəndə hər hörüyü bir qolac.* M.P.Vaqif. // *sif.* Uzun mənasında. *Xaqanlar başına şeşpər daldıran; Qolac qollar buran qoç Koroğludur.* "Koroğlu". *Bəs onun gülər üzü hanı, qolac saçları, dəyirmi sifəti?* Mir Cəlal.

**QOLAC-QOLAC** *sif.* Uzun-uzun. *Qolac-qolac saçlar.*

**QOLACLAMA** "Qolaclamaq"dan *f.is.*

**QOLACLAMAQ** *f. dan.* 1. Qolacla ölçmək.

2. Qollarını qabağa uzatmaq. *Alo kişi adamlara tərəf qollarını qolaclayıb* [dedi:] *– A balam, niyə məəttəlsiniz!* S.Rəhimov.

**QOLACLANMA** "Qolaclanmaq"dan *f.is.*

**QOLACLANMAQ** *məch. dan.* Qolacla ölçülmək.

**QOLAY** *sif.* 1. Asan, zəhmətsiz, yüngül. *Mənim sənətim bildiyin qədər də qolay deyildir.* A.Şaiq. *Boz şinel isə soyuq keçməyən bir qalaydı; Bu geyimlə dağlarda gəzmək ona qolaydı.* S.Rüstəm. *Sən bu canlara sataşmağı sanırsanmış qolay; Öylə bir fikirdəsənsə, yanılırsan, hay, hay!* Ə.Nəzmi.

2. Münasib, uyğun, rahat. *Bu yer mənə qolay deyildir.*

3. Bikara, yüngül. *Əfruz bacı aldığı toyuqların seçməsini damazlıq üçün saxlayır, qolayını isə kəsdirirdi.* S.Rəhimov.

**QOLAYCA** *sif.* 1. Çox asan, zəhmətsiz, çox yüngül. *Qolayca iş. Bu işi qolayca* (z.) *görmək olar.*

2. Uyğun, münasib, rahat. *Qolayca bir yer tapıb oturdum.*

**QOLAYLANMA** "Qolaylanmaq"dan *f.is.*

**QOLAYLANMAQ** *f.* Birini vurmaq və ya bir şey atmaq üçün qolunu qaldırıb dala gərmək. *Buğac .. ceyranı hərləyib xanın lap yaxınında əlini kəməndə atıb qolaylandı.* M.Rzaquluzadə.

**QOLAYLAŞDIRILMA** "Qolaylaşdırılmaq"dan *f.is.*

**QOLAYLAŞDIRILMAQ** *məch.* Asanlaşdırılmaq, yüngülləşdirilmək.

**QOLAYLAŞMA** "Qolaylaşmaq"dan *f.is.*

**QOLAYLAŞMAQ** *f.* Asanlaşmaq, yüngülləşmək. *İş get-gedə qolaylaşır.*

**QOLAYLIQ** *is.* 1. Asanlıq, yüngüllük.

2. Uyğunluq, münasiblik.

**QOLAZLAMA** "Qolazlamaq"dan *f.is.*

**QOLAZLAMAQ** *f.* Bir şeyi, qolunun gücü çatdığı qədər uzağa tullamaq, atmaq, tolazlamaq. *Nainsaf .. elə həna göndərib ki, heç zada dəyməz, lap çölə qolazlamalıdır.* N.Vəzirov.

**QOLBAĞI** b a x **qolbaq**. *Qızılgül əndamlı, lalə yanaqlı; Qolbağılar cumur qollara doğru.* Aşıq Vəli.

**QOLBAQ** *is.* Qadınların biləklərinə taxdıqları qızıl, gümüş və s.-dən düzəldilmiş halqa bəzək; bilərzik, bazubənd. *Qızıl qolbaq. Gümüş qolbaq. – Oynadar, şaqqıldadar qızlar qızıl qolbaqların.* M.Möcüz. *Dövlətli qadın .. qollarına qızıl qolbaqlarını keçirib, başına al rəngli Şirvan ipək çarşabını sal*(*dı*). H.Sarabski.

**QOLBAQLI** *sif.* Biləyində qolbaq olan, qoluna qolbaq keçirmiş. *Qolbaqlı qız.*

**QOLBƏND** *is.* Qolbaq. // Bazubənd. □ **Qolbənd eləmək** – cidarlamaq. *Atı qolbənd eləyən Sarı İmaməli xaldar tulanın xaltasından bərk-bərk yapışmışdı.* S.Rəhimov.

**QOL-BOYUN** *zərf* Qucaqlaşaraq, qollarını bir-birinin boynuna salaraq. □ **Qol-boyun olmaq** – qucaqlaşmaq. *Dur, qol-boyun olaq fürsət var ikən; Nə qəmə, qüssəyə batmaq çağıdır?* Q.Zakir.

**QOL-BUDAQ** *top.* 1. Ağacın böyük və kiçik şaxələri. *Hündür, dümdüz şam ağaclarının qol-budaqları üşüyürmüş kimi qar ləpələri altında titrəşirdi.* M.İbrahimov. □ **Qol-budaq atmaq** – 1) şaxələnmək, ətrafa yayılmaq, genişlənmək. *Hələ qış aylarında*

*torpağa basdırılmış soyuğa davamlı gül şitilləri açıq havada artıq qol-budaq atmağa başlamışdı. – Keçən il gətirdiyim ağacların hərəsi 25 santimetr, eləsi var, yarım metr qol-budaq atıb.* Mir Cəlal; 2) *məc.* inkişaf etmək, tərəqqi etmək, artmaq. *O görür qol-budaq atmış quruluş; O görür ki, başa çatmış quruluş.* S.Rüstəm.

2. *məc.* Əl-ayaq, ətraf üzvlər. *Qol-budağım qırıldı.*

3. *məc. dan.* Qohum-qardaş, əqrəba və yaxın adamlar mənasında.

**QOL-BUDAQLI** *sif.* Böyük şaxələri, budaqları olan. *İçimdə bir qəzəb baş qaldırır; qol-budaqlı ağacların bu mütiliyinə; qüvvət qarşısında bu acizliyin.* R.Rza.

**QOLÇAQ** *is.* 1. İş zamanı qola taxılan, qalın parçadan, dəridən və sairədən hazırlanan xüsusi qol geyimi və ya sarğı. *Dəmirçi qolçağı. Çörəkçi qolçağı.*

2. Qədim zamanlarda müharibələrdə qola taxılan dəmir və ya poladdan xüsusi şəkildə hazırlanmış geyim, ümumiyyətlə, qolu zərbədən qorumaq üçün ona keçirilən, ya sarılan hər cür qoruyucu. *Polad qolçaq qoluma; Dəlilər sağü soluma; At minəm düşəm yoluma; Çənlibel durağım ola.* "Koroğlu". *Bax, əynində çox qiymətli, yaxşı dəmir geyim var; Dəyərlidir qollarında olan polad qolçaqlar.* A.Səhhət.

**QOLÇOMAQ** *is.* 1. Yoxsulları, muzdurları istismar edən dövlətli kəndli. *..Molla Rəcəb bir dəstə kənd qolçomaqları ilə və bəyləri ilə bir yerdə həbsə alınıb, dama salındı.* B.Talıblı.

2. *köhn.* Yoxsulları, fağırları əzən, incidən, onlara zülm edən adam; qoluzorlu, qoçu. *Ey qolçomaq, əlsizlərə çox eyləmə azar; Zənn etmə ki, daim belə qızğın qala bazar.* M.Ə.Sabir.

**QOLÇOMAQLIQ** *is.* 1. *top.* Qolçomaqlar. *Qolçomaqlığın bir sinif kimi ləğv edilməsi. Ellikcə kollektivləşmə qolçomaqlığın ləğv edilməsi demək idi.*

2. Qolugüclülük, zorbazorluq; zülm, haqsızlıq.

**QOLFİ** *is.* [*fr.*] Qısa qadın corabı.

**QOLFSTRİM** [*ing.*] *coğr.* Atlantik okeanında: Meksika körfəzindən şimal-şərqə doğru axan və Avropanın şimal-qərb tərəfinin iqlimini yumşaldan isti cərəyan.

**QOL-QABIRĞA** *is.* Bədənin qol və qabırğalar olan hissəsi. ☐ **Qol-qabırğasını əzmək (qırmaq, qırıb tökmək)** – döymək, əzişdirmək, kötəkləmək. *On il bundan əvvəl Zeynəb bircə vaxt namazını keçirsəydi, anası onun qol-qabırğasını qırıb tökərdi.* Qantəmir. **Qol-qabırğasını sındırmaq** – 1) bax **qol-qabırğasını əzmək**. [Qafar:] *Yaxşısı budur ki, sənin qol-qabırğanı sındırmamış buradan gedim.* S.S.Axundov; 2) *məc.* korlamaq, bərbad hala salmaq, təhrif etmək. *Sözlərin qol-qabırğasını sındırmaq.*

**QOL-QANAD** *is.* 1. Bax **qanad** 1-ci mənada.

2. Şaxə, qol-budaq. *Ot saçaqları sallanan bir təpədə iri qol-qanadı qurumuş bir ağac vardı.* Çəmənzəminli. ☐ **Qol-qanad atmaq** – şaxələnmək, yayılmaq, genişlənmək, inkişaf etmək, böyümək. *Budaqların böyüməsi, qol-qanad atması üçün mahir bir bağban əli lazım idi..* Ə.Vəliyev.

◊ **Qol-qanad açmaq** – 1) qanadlanmaq, uçmaq üçün qanadlarını açmaq; 2) *məc.* ruhlanmaq, daha da canlanmaq, fəaliyyət göstərmək. *Məni hərgah qovsalar qaçaram; Uçmağa onda qol-qanad açaram.* A.Səhhət. *Ceyran müəllimə qol-qanad açıb, dərsini davam etdirdi.* S.Rəhimov. **Qol-qanad vermək** – ruhlandırmaq, qüvvət vermək, daha da canlandırmaq. *Yarıb fəzaları bir şimşək kimi; Qol-qanad verirsən qəhrəmanlara.* S.Vurğun. **Qol-qanadı açılmaq** – ruhlanmaq, canlanmaq, inkişaf etmək, bədəni bərkişmək. [Hüseynqulu ağa:] *Pəricahan, qızına yazığın gəlsin. Qoy bu qız ilə oynasın, atlansın, qol-qanadı açılsın, bədəni bərkisin, kefi açılsın.* S.S.Axundov. **Qol-qanadı qırılmaq (sınmaq, yanına düşmək)** – 1) köməksiz, adamsız qalmaq; 2) bütün qüvvəti, iqtidarı sarsılmaq, aciz bir hala düşmək, ruhdan düşmək. *Dedi, nişanlıyam, özgə malıyam; Sındı qol-qanadım, yanıma düşdü.* Aşıq Ələsgər. **Qol-qanadını qırmaq (kəsmək, sındırmaq)** – 1) birini köməksiz, kimsəsiz qoymaq. [Qasid:] *Xeyr, xan. Biz belə güman elədik ki, Ağa Məhəmməd xanın əsir olmağı onun qol-qanadını*

*qıracaq. Amma qardaşı tutulandan sonra Cəfərqulu xan ikiqat şiddətlə davaya girişdi.* Ə.Haqverdiyev; 2) birini hərəkət və fəaliyyət qüvvəsindən məhrum etmək, aciz və iqtidarsız bir hala salmaq.

**QOL-QIÇ** *is.* Əl-ayaq, ətraf üzvlər. *Qol-qıçını əzmək. – Tərlan hər gündə döyərdi Laçını; Sındırardı yazığın qol-qıçını.* Ə.Vahid.

**QOL-QOLA** *zərf* Qollarını bir-birinə keçirmiş halda. *Qol-qola gəzmək. Qol-qola sürüşmək. – Önümüzdə dursa da min əngəl, min təhlükə; Gəzəcəyik səninlə qol-qola ölkə-ölkə.* S.Rüstəm. *Nə dayanmaq vaxtıdır, gözəl dostum, sən də gəl! Seyr edəlim qol-qola bu zümrüd çəməndə, gəl!* M.Müşfiq. *Bu gələn bayramda çataq murada; Toyunda qol-qola süzək, barışaq.* Aşıq Məhəmməd. ☐ **Qol-qola vermək** – 1) bir-birinin qolundan tutmaq. [Rüstəm] *faytonçunu yola salıb, Əkbərlə qol-qola verib pilləkəndən yuxarı çıxdı.* Ə.Haqverdiyev; 2) *məc.* köməkləşmək, bir yerdə, bərabər, əlbir olaraq çalışmaq, işləmək. *Qol-qola verib işləmək.*

**QOLLU** *sif.* Qolları olan. *Qollu jaket. Qollu paltar.*

**QOLLU-BUDAQLI** *sif.* Çoxlu qolları olan. *Qollu-budaqlı ağac. – Dağlıq, yamaclıq yerlərdə dağın və yamacın ətəyindən başlayaraq, ətrafa qollu-budaqlı lağımlar atırlar.* Ə.Vəliyev.

**QOLLU-QANADLI** b a x **qol-budaqlı**. *Şəhərin kənarındakı qollu-qanadlı ağacların yaşıl budaqları alaçığa çevrilərək ağacların diblərini quru saxlayırdı.* S.Rəhimov.

**QOLORDU** *is. hərb. köhn.* Bir neçə diviziya, ya briqadadan ibarət iri qoşun birləşməsi; korpus.

**QOLSUZ** *sif.* 1. Qolu olmayan. *Qolsuz mayka. Qolsuz köynək. Qolsuz jilet. – Uşaqlar çox vaxt qolsuz bir köynəklə yaşıl ot üstündə ayaqyalın gəzirlər.* Mir Cəlal.

2. Bir qolu olmayan (kəsilmiş). *Qolsuz adam. Qolsuz qəhrəman.*

**QOLSUZ-QANADSIZ** *sif.* Aciz, hər cür imkandan məhrum; bir iş görməyə imkanı, bacarığı olmayan.

**QOLTUQ** *is.* 1. Qolun, döşün yanı ilə çiyin bəndinin altındakı hissəsi, qolun çiyinlə birləşdiyi yerin altındakı çuxur. *Kitabı vurun qoltuğunuza və Arazı hoppanın, keçin .. vətəninizə.* C.Məmmədquluzadə. *Götürüb qoltuğuna çantasını; Məktəbə şövqi-tamam ilə gedir.* A.Səhhət. *Dağlardan gah çantası quş dolu ovçular, gah da qoltuğu kitablı məktəbli uşaqlarının endiyini gördüm.* S.Rüstəm. *Atası iki əli ilə qoltuğunun altından yapışıb onu havaya qaldırar, atıb-tutardı.* M.Rzaquluzadə. ☐ **Qoltuq cibi** – paltarın iç tərəfində döşün üstünə düşən cib. *Xudayar bəy çubuğu doldurub, .. əlini qoltuq cibinə uzadıb və bir çimdik qov çıxardıb tutdu .. ağanın qabağına.* C.Məmmədquluzadə. [Məhbusi] *sonra şalvarın cibinə soxuşdurduğu yüz tüməni çıxarıb səliqə ilə bükdü və qoltuq cibinə qoydu.* M.İbrahimov.

2. Çay və ya dəniz sahilində su girintisi, körfəz.

◊ **Qoltuğa girmək** – 1) gəzə bilməyən və ya xəstə bir adamın yeriməsinə kömək etmək, onu ayağa qaldırmaq; 2) sıxılmaq, özünü gizləmək, ortaya çıxmamaq, küncbucağa qısılmaq. **Qoltuğa sığınmaq** – 1) b a x **qoltuğa girmək** 2-ci mənada; 2) pənah aparmaq, birinin himayəsi altına girmək. **Qoltuğa soxulmaq** – b a x **qoltuğa girmək** 2-ci mənada. **Qoltuğu altına almaq** – himayəsi altına almaq, pərəstarlıq etmək. **Qoltuğu şişmək** – b a x **qoltuğunun altı şişmək**. *Padşah fərəhləndi ki, belə bir qulu var. Qonaqların yanında qoltuğu şişdi.* (Nağıl). **Qoltuğuna qarpız vermək** – 1) çox tərifləmək, həddindən artıq şişirtmək; 2) ələ salmaq məqsədilə birini üzünə tərifləmək. **Qoltuğuna vermək (papağını, xoruzunu, şələsini** və s.**)** – 1) biabır etmək, ifşa etmək; 2) rüsvayçılıqla qovmaq. *Həsənağa kimi zalımın biri getdi naçalnikdən xahiş elədi, bir də görəcəksən, papağımı qoltuğuma verib saldılar eşiyə.* Ə.Haqverdiyev. **Qoltuğunun altı şişmək** – lovğalanmaq, təşəxxüslənmək, qürrələnmək (təriflənmək nəticəsində). **Qoltuğunun altına (qarpız) vermək** – birini həvəsləndirmək, bir işi gördürmək, yaxud ələ salmaq üçün yalandan üzünə tərifləmək. **Qoltuq altında yaşamaq** – birinin himayəsi altında yaşamaq.

**QOLTUQAĞACI** *is.* Topal və ya ayağı xəstə adamların gəzərkən qoltuqlarının altına

qoyub dayaq kimi istinad etdikləri ağac. *Qoltuqağaclarına söykənib kamançalan; Kölgələr əl uzadır, kim ötüb keçsə yoldan.* Ə.Cəmil.

**QOLTUQALTI** *is.* Qoltuq altına qoyulan kiçik yastıq.

**QOLTUQÇU** *is. köhn.* Qoltuğunda parça və başqa şeylər gəzdirib satan adam; xırdavatçı. *Qoltuqçu malları açıb tökdü, gözəl firəng və İstanbul qumaşları şairi heyran qoydu.* Çəmənzəminli. [Ələmdar] *qoltuqçunun çiynindəki paltonu götürüb geydi.* S.Rəhimov.

**QOLTUQÇULUQ** *is. köhn.* Qoltuğunda parça və xırdavat gəzdirib satmaq peşəsi; xırdavatçılıq. [Xəlil:] *Mənim sənətim qoltuqçuluqdu, yəni dörd-beş top çit qoltuğuma vurub dolanıram öz kəndimizi.* C.Məmmədquluzadə.

**QOLTUQFÜRUŞ** [qoltuq və *fars.* ...füruş] *köhn.* b a x **qoltuqçu**.

**QOLTUQFÜRUŞLUQ** *is. köhn.* b a x **qoltuqçuluq**. [Hacı Rəcəbəli:] *Bu da marağalı Hənifədir ki, gündüz qoltuqfüruşluq edir, gecələr mənim yanımda olur.* M.F.Axundzadə.

**QOLTUQLAMA** "Qoltuqlamaq"dan *f.is.*

**QOLTUQLAMAQ** *f.* 1. Bir şeyi qoltuğuna vurmaq, qoltuğuna almaq, qoltuğuna keçirmək.

2. Qolunu başqasının qoluna keçirmək, birinin qoluna girmək. *Adamların hay-küyü yaxınlaşır.. Hacı Həsən bir tərəfdən və Şeyx Əhməd bir tərəfdən, Şeyx Nəsrullanı qoltuqlayıb gətirirlər içəri və oturdurlar döşəyin üstündə.* C.Məmmədquluzadə. *Süfrə başından durdular, hərə bir tərəfə çəkildi, yenə də Sərdar Rəşid məni qoltuqladı.* M.S.Ordubadi.

**QOLTUQLANMA** "Qoltuqlanmaq"dan *f.is.*

**QOLTUQLANMAQ** "Qoltuqlamaq"dan *məch.*

**QOLTUQLU** *sif.* Qoltuğu söykəmək üçün xüsusi yeri olan. *Qoltuqlu kürsü. Qoltuqlu stul. – ..Adəti üzrə məni dalı-dalı aparıb qoltuqlu sandalyada oturtdu.* M.S.Ordubadi.

**QOLTUQSAZI** *is. mus.* Orta həcmli, beşsimli saz. *Çayçı dükanlarında .. əvvəlcə qoltuqsazı çalıb şikəstə oxuyardılar.* H.Sarabski.

**QOLUBAĞLI** *zərf* və *sif.* Qolları bağlı; qolları bağlı olduğu halda. *Qolubağlı keçdim Xudafərindən; Üzüm gülməz, heç açılmaz, ah, mənim.* Qurbani. *Məmməd bəy vuruşmadan başı açılan kimi, Mustafa xanın buraxıb getdiyi karvana tərəf gəldi. Burada bir dəstə qolubağlı əsir vardı.* Çəmənzəminli. *Səhər olmuşdu ki, Fərhad bəyi qolubağlı kəndə gətirdilər.* Qantəmir.

**QOLUÇİRMƏKLİ** *sif.* və *zərf* Paltarının qolları qaldırılmış. *Qoluçirməkli işləmək. – Qoluçirməkli uzunboy xəmirgir işarə ilə taxtın üstünü göstərdi.* Mir Cəlal.

**QOLUGÜCLÜ** b a x **qolçomaq** 2-ci mənada. *Ayna Mirzə Polad müəllimin gizli işlərə qoşulduğunu, qolugüclülər qabağına çıxıb, fəqir-füqəra tərəfdə dayandığı günlərdən narahat olmağa başlamış*(*dı*). S.Rəhimov.

**QOLUGÜCLÜLÜK** *is.* b a x **qolçomaqlıq** 2-ci mənada. *Hər yerdə, hər mühitdə haqsızlığın, qolugüclülüyün, zorbalığın əleyhinə çıxışlar olurdu.* S.Hüseyn.

**QOLUKƏSİK** *sif.* Bir qolu kəsilmiş, bir qolu olmayan. *Qolukəsik adam.*

**QOLUQ** b a x **qovluq**. *Sübhanverdizadə hər bir qoluğu əlində sanballayıb çəkdi və dodaqaltı mırıldandı: – Ünsür .. sənin canın buradadır!..* S.Rəhimov.

**QOLUQÜVVƏTLİ** *sif.* Güclü, qüvvətli, sağlam. *Bu az zamanda neçə-neçə gözəl oğlanlar, qoluqüvvətli, ürək-təpərli öz müsəlman qardaşlarının əlində badi-fənaya gedib...* N.Vəzirov.

**QOLUZORBA** b a x **qolçomaq** 2-ci mənada. *Bakı qubernatoru Bakı varlıları və Bakı qoluzorbaları ilə görüşmək və vidalaşmaq qərarına gəlmişdi.* M.S.Ordubadi. *İndi ona yaxın düşməkmi olar? Özü güclü-zorlu, başında qoluzorba quldurlar.* M.Rzaquluzadə.

**QOLUZORBALIQ** b a x **qolçomaqlıq** 2-ci mənada.

**QOLUZORLU** *sif.* və *is.* 1. B a x **qoluzorba**.

2. Güclü. *Yekəpərlər, qoluzorlular özlərini verirlər qabağa, zəifləri, xüsusən qadınları və uşaqları sıxışdırırlar dala.* "Kirpi".

**QOM** *is.* Dəstə, topa, bir yerdə bağlanmış şey. *Bir qom çubuq. – Suyun bir hissəsini arxa döndərmək üçün adamlar məftil ilə sarınmış şax-şəvəldən hər birisi iki yük maşını boyda "qomlar" düzəldib çaya salırdılar.* İ.Əfəndiyev.

**QOMARLAMA** "Qomarlamaq"dan *f.is.*

**QOMARLAMAQ** *f. məh.* Dövrələmək, dövrəyə almaq, mühasirəyə almaq. *İtlər paltarı su çəkib ağardılmış Safonu qomarladılar.* S.Rəhimov. *Onların hər ikisi tüfəngini doldurub, dışarı çıxana qədər yasavullar evi qomarladılar.* M.Hüseyn.

**QOMARLANMA** "Qomarlanmaq"dan *f.is.*

**QOMARLANMAQ** *məch. məh.* Dövrələnmək, dövrəyə alınmaq, mühasirəyə alınmaq.

**QOMİNDÁN** Çində 1949-cu ildə qalib gəlmiş xalq inqilabı tərəfindən devrilmiş iri burjuaziya və mülkədarların partiyası.

**QOMİNDANÇI** *is.* Qomindan partiyasının üzvü, tərəfdarı.

**QOMLAMA** "Qomlamaq"dan *f.is.*

**QOMLAMAQ** *f.* Dəstə ilə bağlamaq, toplamaq, yığıb bir yerdə bağlamaq.

**QONAQ** *is.* 1. Görüşmək üçün və ya başqa bir məqsədlə birinin evinə gələn adam. *..Naçalnik yanına gələn qonaqlar ilə düşmüşdülər Hacı Namazalının evində.* C.Məmmədquluzadə. *Qonaqlar üçün papirosla maxorka da gətirilmişdi.* M.Hüseyn. □ **Qonaq etmək (eləmək)** – məmnuniyyətlə vermək, təklif etmək (yemək, içmək və s.). [Yusif:] *Bu gün dostum Nizaminin bağçasında hamını ceyran kababı ilə şəraba qonaq edəcəyəm.* M.Hüseyn. **Qonaq getmək** – çağırılmış bir yerə, qonaqlığa getmək. **Qonaq gəlmək** – bir yerə görüşə gəlmək. *Günlərin birində Fəridə ərinin evindən ata-anasıgilə qonaq gəldi.* M.Hüseyn. **Qonaq otağı** – evdə qonaqlara, görüşə gələnlərə məxsus xüsusi otaq. // Birinin başqa bir yerdə (kənddə, şəhərdə) yaşayan tanışı, bir-birinin evində qonaq qalan adamlardan hər biri. *Bu kənddə bizim bir qonağımız var.* // Ziyafətə, bayrama və s.-yə dəvət olunmuş adam. *Bozbaşdan doymaq istəyirsənsə, qonaqlarını tox yola salmaq istəyirsənsə, çölməyə çox ət sal.* C.Məmmədquluzadə. *Ziyafət başlanmamışdı, sanki ziyafətin başlanması üçün möhtərəm bir qonağın intizarı çəkilirdi.* M.S.Ordubadi.

2. *məc.* Müvəqqəti olaraq bir yerə düşmüş, bir yerdə qalan adam; gəldi-gedər. [Xudayar bəy odabaşıya:] *..Bu gecə sənə qonağam, Kərbəlayı Cəfər əmi.* C.Məmmədquluzadə. *Bir gecəlik qonağa ev sahibi nə versə, ona da şükür.* M.İbrahimov. // Eyni mənada quşlar haqqında. *Bu quşlar yazda bizim yerlərdə qonaqdırlar.* □ **Qonaq qalmaq** – bir yerdə gecələmək, gecə, ya gündüz azacıq bir zaman üçün bir yerə düşmək, bir yerdə qalmaq. *Bir günlük burada qonaq qalacağam.* // Bir iclasda, yığıncaqda, bayramda, şənlikdə və s.-də iştirak etməyə dəvət edilmiş kənar adam. *Qonaqlar üçün yer. O, iclasda qonaq sifəti ilə iştirak edir.*

**QONAQCIL** b a x **qonaqpərəst**. [Qulam dayı:] *Məşədibəy qonaqcıl oğlandır. Hökumət adamıdır.* M.Hüseyn.

**QONAQCILLIQ** b a x **qonaqpərəstlik**. *Qoyar dost yolunda olan-olmazın; Bəllidir elimin qonaqcıllığı.* M.Rahim.

**QONAQÇI** *is.* Qonaq saxlayan adam, evinə qonaq qəbul edən adam; qonaqsevən, qonaqpərəst. *Bu gecə sizin qonaqçı və məhəbbətli bir zat olduğunuz bizdə unudulmaz bir xatirə buraxdı.* M.S.Ordubadi. *Yola salırdı qonaqçı bizi nəzakətlə.* M.Möcüz.

**QONAQ-QARA** *is. dan.* Qonaq(lar). *Onun həmişə qonaq-qarası olur.*

**QONAQ-QARALI** *sif. dan.* Həmişə qonaqları olan. *Qonaq-qaralı ev.*

**QONAQLAMA** "Qonaqlamaq"dan *f.is.*

**QONAQLAMAQ** *f.* Qonaq etmək, qonaq saxlamaq. *Vəliəhdi qonaqlamaq üçün evdə olan yeməklər aralığa gətirildi.* M.S.Ordubadi.

**QONAQLIQ** *is.* Bir münasibətlə tanışları evinə və ya başqa yerə dəvət edib, onları yedirib-içirmə; ziyafət. *Qonaqlıq düzəltmək. Qonaqlığa getmək. Qonaqlıq eləmək. Bu gün gələn qonaqların şərəfinə böyük bir qonaqlıq verildi. – Dedim: – Əzizim, Lağlağı, .. səbir elə, görək İbrahim bəy Təbrizin qonaqlıq məclisindən nə yazır?* C.Məmmədquluzadə. [Nəbi:] *Cəbi, bu gecə bizdə böyük qonaqlıq var.* S.S.Axundov. *Dünən Qazanxanın qəsrində qonaqlıq idi.* M.Rzaquluzadə.

**QONAQPƏRƏST** *sif.* [qonaq və *fars.* ...pərəst] Qonaqsevən; evinə gələn qonağa çox hörmət edən. *Qonaqpərəst adam. – Bizim yerlərdə sizə əziz bir qonaq kimi hörmət edirdilər, baba, .. xalqımız son dərəcə qonaqpərəstdir.* M.Hüseyn. *Bu qədər qonaqpərəst bir ailədə yaşadığına baxmayaraq, son dərəcə darıxır.* S.Rəhman.

**QONAQPƏRƏSTLİK** *is.* Qonağa çox hörmət etmə, qonağı hörmətlə qəbul etmə.

..*Fikirləşdim ki, qonaqpərəstlik buralarda çox olsa da, hər evə getmək yaxşı deyil.* Mir Cəlal.

**QONAQPƏRVƏR** [qonaq və *fars*. ...pərvər] bax **qonaqpərəst**.

**QONAQPƏRVƏRLİK** bax **qonaqpərəstlik**.

**QONAQSEVƏN, QONAQSEVƏR** bax **qonaqpərəst**. [Liza:] *Yox, yox, o çox qonaqsevəndir*. M.Hüseyn.

**QONAQSEVƏNLİK, QONAQSEVƏRLİK** bax **qonaqpərəstlik**. [Mədinənin] *mehribanlığı, zarafatı, qonaqsevənliyi, hazırcavablığı Vaqifi məftun edərdi.* Çəmənzəminli.

**QONAQSEVMƏZ** *sif.* Qonaq xoşlamayan, qonaq qəbul etməyən.

**QONAQSEVMƏZLİK** *is.* Qonaq sevməmək xasiyyəti.

**QONÇUNÁ** [*rus*. кончи́нка] *dan.* Qumar oyunlarından birinin adı. [Nəbi:] *Onda mənlə bir əl qonçuna oynamaqla necəsən?* S.S.Axundov.

**QONDARA** *is*. *köhn*. Ayaqqabı. [Çəkməsilən:] *Ay qondarasını sildirən, ay mənə bir siftə verən!* M.S.Ordubadi.

**QONDARAÇI** *is. köhn.* Çəkməçi, ayaqqabıtikən.

**QONDARILMA** "Qondarılmaq"dan *f.is.*

**QONDARILMAQ** *məch.* 1. Uydurulmaq, özündən düzəldilmək. *Ancaq bu ailəni atılan çirkablar, qondarılan sözlər hər tərəfdən sıxırdı*. S.Rəhimov.

2. Qurulmaq, qayrılmaq, düzəldilmək, tikilmək.

**QONDARMA** 1. "Qondarmaq"dan *f.is.*

2. *sif.* Uydurma, saxta, süni, əsli olmayan, yalançı. *Qondarma xəbər.* // İs. mənasında. *Hər bir şeyin qondarması bir qəpiyə dəyməz.* C.Məmmədquluzadə. [Bəhram:] *qondarmalarına müqabil təşəkkürlər edirəm, Pəri!* C.Cabbarlı.

3. *sif.* Quraşdırma, quraşdırılan. *Arı saxlanan yeri açıb bərkitmək asan olsun* [deyə] *Avropa əhli onları cürbəcür qondarma qutular içində saxlayır.* H.Zərdabi.

**QONDARMAÇILIQ** *is.* Uydurmaçılıq; özündən düzəltmə, uydurma.

**QONDARMAQ** *f.* 1. Uydurmaq, özündən düzəltmək, özündən toxumaq, özündən icad etmək. *Söz qondurmaq*. – [Mirzə] *özündən qondarıb başqa söz yazır*. S.Rəhimov.

2. Üzərinə artırmaq, sonradan əlavə etmək. *İstədin qaş qondarasan, gözü vurub çıxartdın!* (Ata. sözü.) ..*Söz yox ki, mənə xoş gəlmir ki, atam, anam qoyduqları adımın yanına bir özgə ad qondaralar.* C.Məmmədquluzadə.

3. Qurmaq, qayırmaq, düzəltmək, birtəhər tikmək. *Naşı bənna qondarıbdı növdanı, xalq neyləsin?* M.Möcüz. *O, özü öz əli ilə bu peçin yerini təyin etmiş, üz-gözünü qaralayaraq, trubalarını qondarmışdı*. S.Rəhimov.

**QONDOLA** *is.* [*ital.*] Yastıdibli, biravarlı qayıq.

**QONİT** *is.* [*yun.*] Diz oynağının iltihabı.

**QONKÁ** [*rus*. ко́нка] *köhn.* Keçmişdə, hələ elektrik tramvayı olmadığı zaman, şəhərlərdə rels üzərində atla işləyən dəmiryol vaqonu. [Xortdan:] *Həmişə qonkaya minərdi ki, haraya istəsəydi, bircə şahı manata aparırdılar.* Ə.Haqverdiyev. *Şəhərdə nə fayton, nə də qonka işləyirdi*. A.Şaiq.

**QONQ** *is.* [*ing*.] 1. Metal disk şəklində zərbli musiqi aləti.

2. İdman yarışının başlanmasını bildirən siqnal.

**QONMA** "Qonmaq"dan *f.is.*

**QONMAQ** *f.* 1. Yuxarıdan, havadan enərək bir şey üzərində oturmaq, dayanmaq; enmək. *Sərçələr söyüd ağacına qondular.* – *Pendir ağzında bir qara qarğa; Uçaraq qondu bir uca budağa.* M.Ə.Sabir. *Bir qaya başına qartal qonaraq; Dayanmış yenə də sakit vüqarla!* S.Vurğun. *Sığırçınlar səhər çağı gələr, budaqlara qonub səslənər, baharın müjdəsini gətirərlər*. Mir Cəlal. // Yerə enmək. *Təyyarə meydançaya qondu. – Aeroplan çölə qondu.* Ə.Məmmədxanlı. // Toz haqqında – çökmək, oturmaq. *Paltarına toz qonmaq. Stolun üstünə bir barmaq toz qonubdur*. // Cəld oturmaq, əyləşmək, minmək. *Qoç Koroğlu qonar olsa yəhərə; Yağı düşmənləri salar qəhərə*. "Koroğlu". *Oğlan bir anda* [buğanın] *başına qonub bıçağını çəkdi, boğazını kəsdi*. M.Rzaquluzadə.

2. *məc.* Çökmək, təzahür etmək, ifadə etmək. *Qeyri-adi bir kədər uşağın gözlərinə qonmuşdu*. M.İbrahimov. [Qızın] *üzünə qo-*

*nan sevincli bir təbəssüm güzgü kimi Beyrəyin də üzündə əks etdi*. M.Rzaquluzadə.

3. *məc.* Şığımaq, hücumla birinin başının üstünü almaq. *Əsgərlərimiz şahin kimi düşmən üzərinə qondular.*

**QONOKÓKK** [*yun.*] *bakt*. Süzənək mikrobu.

**QONORÁR** [*lat.*] Yazıçılara, rəssamlara, vəkillərə və başqalarına müqavilə üzrə verilən zəhmət haqqı. *Müəllif qonorarı. Qonorar almaq*. – [Reyhan:] *Məlahətin əri böyük mühəndisdir. Kitabları, məqalələri çap olunur.* [Çoxlu] *qonorar alır*. İ.Əfəndiyev.

**QONSƏ** *is*. Quş qursağı. [Yırtıcı quşlarda] *pərtdənəkdən xörək əsil mədəyə gedir ki, orada ona həzm suları qarışır. Sonra ikinci mədəyə gedir ki, bu mədəyə qonsə deyirlər*. H.Zərdabi.

**QONŞU** 1. *is.* Birinin bilavasitə yaxınlığında, yaxud birisi ilə yanaşı yaşayan adam. *Həyət qonşusu. Ev qonşusu. Otaq qonşusu. Qapı qonşusu. – Qonşumuz Kərbəlayı Heydərin iki oğlu var idi*. C.Məmmədquluzadə. *Pələngin dərisini soyub, evə dönərkən qonşular başıma toplandı.* A.Şaiq. *Bu zaman qonşunun kamanı dilləndi.* İ.Əfəndiyev.

2. *sif.* Qonşuluqda, bilavasitə yaxınlıqda, ya yanaşı olan. *Qonşu həyət. Qonşu ev. Qonşu otaq. Qonşu ölkə*. – [Almaz:] *Bu, mənim nişanlımın ən yaxın bir dostudur. Qonşu kənddə müəllimdi..* C.Cabbarlı. *Qonşu həyətin qapısı başqa küçəyə açılırdı.* Mir Cəlal. *Rəhim bəy rəngi kül kimi bozarmış halda cəld addımlarla qonşu otağa keçdi.* M.Hüseyn.

**QONŞUCUĞAZ** "Qonşu"dan *oxş*. *Gedib dedi: – Qonşucuğaz, mənim üçün bal ver bir az; Qonağım var, süfrəm boşdur.* M.Dilbazi.

**QONŞULAŞMA** "Qonşulaşmaq"dan *f.is.*

**QONŞULAŞMAQ** *f.* Qonşu olmaq, bir-birinə yaxın yerdə sakin olmaq. *O, başqa bir məhəllədən köçüb bizimlə qonşulaşdı.* // Bir-birinə yaxınlaşmaq.

**QONŞULUQ** *is.* Yaşadığı yerə görə bir-birinə bilavasitə yaxınlıq. *..Çoxdan bilirdi ki, onun qonşuluğunda usta Cəfər adlı məharətli bənna var.* C.Məmmədquluzadə. *Demək olar ki, onunla tanışlıq və ya dostluğumuz qonşuluq ilə başlanır və qonşuluq ilə bitir.* Mir Cəlal. *Xanpəri Gözəlin qonşuluğunda olurdu.* Ə.Vəliyev.

**QONU(M)-QONŞU** *top. dan.* Yaxın və uzaq qonşular, ətrafdakı qonşular. *Qonum-qonşu yeksər verib baş-başa; Gecə-gündüz sizin üçün ağlaşa.* Q.Zakir. *Bu qədər qışqırığa durdu qonum-qonşu tamam.* M.Ə.Sabir. *Dərviş o qədər gözəl təqlid edirdi ki, qonum-qonşu heyran qalırdı*. S.Rəhman. *Gecə yarısı yatmış olan camaat və qonum-qonşu hamısı səsə ayılardı*. H.Sarabski.

**QONUR** *sif.* Şabalıd rəngli, açıq-qəhvəyi. *Qonur at. Qonur torpaq. – Söylə görək, Beyrək adlı boylu-buxunlu, qara, qıvırcıq saçlı, qonur, şəhla gözlü .. bir igid görmədinmi?* M.Rzaquluzadə.

**QONURGÖZ(LÜ)** *sif.* Gözləri qonur (şabalıdı) olan. *Bunların* [əsirlərin] *içində buğdayısifət, qonurgözlü, uzun kirpikli bir qız vardı.* Çəmənzəminli. *İdris .. qonurgözlü bu qızı tanımışdı*. Ə.Məmmədxanlı.

**QONURLAŞMA** "Qonurlaşmaq"dan *f.is.*

**QONURLAŞMAQ** *f.* Qonur rəng almaq, şabalıdı rəngə çevrilmək.

**QONURLUQ** *is.* Qonur (şabalıd) rəngdə olan şeyin halı.

**QONURUMTUL** *sif.* Bir qədər qonur, açıq-şabalıdı.

**QONUŞMA** 1. "Qonuşmaq"dan *f.is.*

2. *is.* Söhbət, danışıq.

**QONUŞMAQ** *f.* Danışmaq, söhbət etmək. *İndi mən gənc şairlə lazımi qədər danışıb qonuşa bilərəm*. M.S.Ordubadi. [Zeynalın] *fikrində vardı ki, əvvəlcə bu ayrılmaq məsələsini, soyuqqanlılıqla bir yerdə ikili qonuşub, .. öz aralarında həll etsinlər*. S.Hüseyn. *Gəl yanıma, sənin ilə qonuşaq; Könlümüzün istəyəni danışaq.* H.K.Sanılı.

**QOPARAQ** *zərf* Tez, çaparaq, cəld, tələsik. *Bu sözü eşidincə, qoparaq onun ardınca getdim*. □ **Qoparağını götürmək** – bax **qoparaqlamaq**.

**QOPARAQLAMA** 1. "Qoparaqlamaq"dan *f.is.*

2. *zərf* Çaparaq, yüyürərək, cəld.

**QOPARAQLAMAQ** *f.* 1. Dalınca qaçmaq, təqib etmək.

2. Bərk qaçmaq, çapmaq.

**QOPARAQLANMAQ** *f.* Cəld qaçmaq, qoparaq getmək.

**QOPARDILMA** "Qopardılmaq"dan *f.is.*

**QOPARDILMAQ** "Qoparmaq"dan *məch.*

**QOPARILMA** "Qoparılmaq"dan *f.is.*

**QOPARILMAQ** 1. "Qoparmaq"dan *məch. Səkinə qoparılmış gül yarpağı kimi solub getməkdə idi*. Mir Cəlal.

2. Ayrılmaq. *Başladığı bu işdən qoparılmaq, aralanmaq və ondan ayrı yaşamaq* [Dəmirova] *havasız bir mühitə düşmək və boğulmaq kimi gəlirdi*. S.Rəhimov.

**QOPARMA** "Qoparmaq"dan *f.is.*

**QOPARMAQ** *f.* 1. Dartaraq və ya çəkərək bir şeyin bir hissəsini ayırmaq, kəsmək, üzmək, qırmaq. *Bloknotdan bir vərəq qoparıb yazdım. Ağacın budağını qoparmaq*. – [Buğaç] *belindəki xəncəri qoparıb, qəbzəsi ilə onun gicgahına bir zərbə vurdu*. M.Rzaquluzadə. *Ayna əyilərək çiçəkləri qoparırdı*. Ə.Məmmədxanlı. // Bütöv bir şeyi başqa bir şeylə vurmaqla və ya dartmaqla onun bir parçasını, bir hissəsini ayırmaq, sındırmaq, aralamaq. *Qənddən bir tikə qopar. Toyuğun budunu qoparıb yedi. Çaynikin lüləyini qopardı. – Kişi çörəkdən bir qulaq qoparıb, etinasız və hətta acıqlı bir hərəkətlə yerə atdı*. M.İbrahimov.

2. Yapışmış şeyi yapışdığı yerdən dartıb ayırmaq, çəkib ayırmaq, aralamaq. *Divarın kağızını, suvağını qoparmaq. Yaranın qartmağını qoparmaq. Dırnağını qoparmaq. – Bunlardan bəziləri əllərində ling, iri daşı yerindən qoparıb, çayın içinə yumalayırdılar*. Ə.Vəliyev. // Kökündən çıxartmaq, yerindən oynatmaq. *Külək ağacı yerindən qopardı. – Kişilər himməti dağı qoparır; Kişi ol, dağ qopar həmiyyət ilə*. M.Ə.Sabir. *Çay bəzən dağ boyda böyüyür, köklü ağacları qoparıb gətirir, öz igidliyindən həzz alır kimi şikarını atıb-tuturdu*. Ə.Vəliyev. // Dartıb çıxarmaq. *At qabaq əllərini qaldırdı göyə və az qaldı noxtanı Kərbəlayı Qasımın əlindən qoparsın*. C.Məmmədquluzadə.

3. *məc.* Ayırmaq. *Ayna gözlərini xalçadan qopardı*. Ə.Məmmədxanlı.

4. Birindən bir şeyi zorla, yaxud hiylə ilə almaq, ələ keçirmək, əldə etmək. *O, deyəsən, yenə bir şey qoparmaq istəyir.*

5. Mübarizə, inadla çalışmaq, əlləşmək, yaxud təhdid, icbar nəticəsində əldə etmək. *1905-ci ildə xalqın qoparmış olduğu xırda siyasi azadlıqları çar mütləqiyyəti yenidən geri almaq istəyirdi.* M.S.Ordubadi.

6. Bir sıra isimlərə qoşularaq, qaldırmaq, etmək, salmaq, yaxud ismin göstərdiyi hərəkətə, işə başlamaq mənasını ifadə edir; məs.: fəryad qoparmaq, gurultu qoparmaq, vəlvələ qoparmaq, haray qoparmaq.

**QOPARTDIRMAQ** "Qopartmaq"dan *icb*.

**QOPARTMA** "Qopartmaq"dan *f.is.*

**QOPARTMAQ** b a x **qoparmaq**. *Köhnə suvağın üstünə təzə suvaq çəksən, köhnəni də divardan qopardıb özü də tökülər yerə.* C.Məmmədquluzadə. [Usta Ağabala] *cəld çərməyi tullayıb, döşlüyü döşündən qopartdı*. Çəmənzəminli. *Fərman ürəyində dedi: "Sarıyataqlının atını oğurlayan yəqin ki, Əhməddir. Görüm boynuna qoyub, bir şey qoparda bilərəmmi?.."* Ə.Abasov.

**QOPMA** "Qopmaq"dan *f.is.*

**QOPMAQ** *f.* 1. Dartılmaq, çəkilmək və s. nəticəsində kəsilmək, üzülmək, qırılmaq. *Paltarın düymələri qopdu. – Sanki onun ürəyi şaxta vurmuş qönçə kimi qopub düşəcəkdi*. Mir Cəlal. // Yapışdığı, bitişdiyi yerdən aralanmaq, ayrılmaq, ayrılıb düşmək. *Divarın kağızı qopmuşdur. Ayaqqabının dabanı qopdu. Kitabın cildi qopdu. Çaynikin qulpu qopmuşdur*. // Kökündən çıxmaq. [Kola bağlanmış ayı] *durub zəncirini dartmağa başladı. Kolun budağı ayının gücünə davam etməyib qopdu.* S.S.Axundov. *Elə bu vaxt Qəhrəman öz kökündən qopmuş ağacın başından yerə gəlir*. S.Rəhimov. // Bütöv bir şeyin bir parçası ayrılıb (sınıb) düşmək.

2. Ayrılmaq, əlaqəsini kəsmək (oturduğu, ya yaşadığı yerdən). *Rza Qəhrəmani cəld hərəkətlə yerindən sıçrayıb, yarıbihuş halda torpaqdan qopmaq istəməyən Məhbusinin qollarını açdı*. M.İbrahimov.

3. Birdən və şiddətlə başlamaq, zahir olmaq, eşidilmək. *Vəlvələ qopdu. – Bir qitə yer üstündə qopub bir yekə dava; Meydan ki qızışdı, olarıq məhv sərapa.* M.Ə.Sabir. *Qopanda qarlı fırtına cahanı tar-mar edər; Qırar, yıxar ağacları, qiyamət aşikar edər.* A.Səhhət. *Yenicə yatağımda uzanmışdım ki, qonşu evdən acıqlı və yanıqlı bir şivən qopdu.* A.Şaiq. // Qalxmaq. *Qoşun pərakəndə bir halda çılpaq çöllərlə gedir, yerdən*

*qopan toz aləmi bürüyürdü.* Çəmənzəminli. *Ata oğlunu belə görəndə sinəsindən odlu bir fəryad qopdu.* M.Rzaquluzadə.

◊ **Yerindən qopmaq** – birdən yerindən sıçramaq, atılmaq, qalxmaq. *Gülsənəm arvad yerindən necə qopduğunu bilmədi.* M.Hüseyn. *O, dəli kimi yerindən qopub, atına sıçradı və ildırım sürəti ilə çapdı.* M.Rzaquluzadə.

**QOPUQ** 1. *sif.* Qopmuş, qırılmış, cırılmış, kəsilmiş, kəsik.

2. *is.* Bir şeyin qopmuş, qırılmış, cırılmış, zədələnmiş, yaxud sınıb düşmüş yeri. *Çaynikin qopuğu. Ayaqqabının qopuğunu yamamaq.*

**QOPUŞMAQ** *qarş.* Hamı birdən yerindən sıçrayıb yüyürmək; cumuşmaq. *Bunu görcək arvad-uşaq, it bağıra-bağıra quruta tərəf qopuşdular.* A.Divanbəyoğlu.

**QOPUZ** *is.* Orta Asiya xalqlarında və qədim Azərbaycanda saza oxşar musiqi aləti. *Ozanlar ozanı Dədə Qorqud gəldi, sədəfli qopuzunu sinəsinə basıb, igidə belə ad qoydu..* M.Rzaquluzadə.

**QOR** *is.* Ocaq və ya təndirdə odun yandıqdan sonra qalan xırda od parçaları, kül arasında işıldayan xırda kömür parçaları. *Ocaqda köz yox, qor var. Qorun üstündə bişirmək. – Başımız üzərində bütün qüvvəti ilə hərarət saçmaqda olan günəş qumsallığı qor halına gətirmişdi.* A.Şaiq.

◊ **Qor dolmaq, qor tökülmək (yerinə, yatağına** və s.**)** – bir an rahat ola bilməmək, gözünə yuxu getməmək. *Mehman sabaha kimi, yerinə bir odlu qor dolmuş kimi, əlləşdi.* S.Rəhimov. *Qorxmazın sözləri qor olub, Salehin yerinə dolmuşdu.* Ə.Vəliyev.

**QORA** *is.* Üzümün dəyməmişi, kalı. *Qora suyu. Qora dişi qamaşdırar. – Saxlaram qora səni; Kal səni, qora səni; Sən getdin, tez gələsən; Kim saldı tora səni.* (Bayatı).

◊ **Gözünün qorasını tökmək (sıxmaq)** – b a x **göz**.

**QORABA** *is.* 1. Qora suyu.

2. Üzüm və müxtəlif meyvə şirəsindən hazırlanan riçal.

3. *məc.* Göz yaşı. *Gözündən tökülən qorabanı əlinin arxası ilə silərək qaşına və yanaqlarına yaydı.* S.Rəhimov.

**QORABAŞI** *is. məh.* Üzüm yetişib qurtardıqdan sonra, təzədən ikinci dəfə yetişməyə başlayan üzüm. *Bu il qorabaşı olmadı.*

**QORABİŞİRƏN** *is.* Üzüm dəyən vaxtı, yayın ən isti vaxtı. *Avqust ayı bizim camaat arasında "qorabişirən ay" adı ilə məşhurdur.* F.Köçərli. *Əlbət, əlbət, elədir, hələ qorabişirən qabaqdadır!* S.Rəhimov.

**QORALEY** *is. zool.* Bədəni göy, qarnı və sifəti ağ köçəri quş.

**QORASUYU** *is.* Abqora, kal üzümün turş şirəsi.

**QORĞANMAQ** *f. məh.* Bir şeyi çox qoruyub saxlamaq, gözdən qoymamaq, üstündə əsmək. *Bəxti malını qorğanır, onun üstündə, doğrudan da, ilan kimi qabıq qoyurdu.* S.Rəhimov.

**QORXACAQ** *dan.* b a x **qorxaq**.

**QORXAQ** *sif.* 1. Qorxu hissinə tez qapılan, ürəksiz, ağciyər, xoflu, cəsarətsiz. *Qorxaq adam. Qorxaq xasiyyət. – Kəndxuda çox qorxaq adamdı. Uryadnikin vurulması onu büsbütün haldan çıxartmışdı.* M.Hüseyn. // İs. mənasında. *Ana yurdu bu şən torpaq; Yetişdirməz xain, qorxaq.* A.Şaiq. [Elxan:] *Ölüm qorxusundan balta altına baş qoymaq qorxaqların işidir.* C.Cabbarlı.

2. *məc. dan.* Qısa, azca qısa və ya kiçik. *Məşədi gedib, arşın əvəzinə babasından qalmış Hacı Mustafa tüfənginin sünbəsini, ki uzunluğu iki arşından bir az qorxaq ola, gətirib atasının ərvahına and içir.* Ə.Haqverdiyev.

**QORXAQCASINA** *zərf* Qorxaq adamlar kimi, qorxaq adama xas olan bir şəkildə. *Qorxaqcasına dala çəkilmək.*

**QORXAQLIQ** *is.* Qorxağa xas olan hal; cəsarətsizlik, ürəksizlik, ağciyərlik. *Çətinlik qarşısında qorxaqlıq göstərmək. Müharibədə qorxaqlıq cinayətə bərabərdir. Ehtiyat qorxaqlıq demək deyil. – Qıraqdan baxanlar müəllimin qorxaqlığına gülmüşdülər.* Mir Cəlal.

**QORXMA** "Qorxmaq"dan *f.is.*

**QORXMAQ** *f.* 1. Bir adam, ya şey, yaxud hadisə və s. qarşısında qorxu hiss etmək, ürkmək, xoflanmaq, qorxaqlıq göstərmək. *Qaranlıqdan qorxmaq. İtdən qorxmaq. –* [Novruz:] *Ağa, nə üçün fikir edirsən, yoxsa*

*qaçaqlardan qorxursan?* N.Nərimanov. // Cəsarət edə bilməmək. *O, qaranlıqda bayıra çıxmağa qorxur*. // Narahat olmaq, təşvişə düşmək, təlaş etmək. *Mahirə qorxmuş kimi dörd yanına boylandı*. M.Hüseyn.

2. Çəkinmək, sağınmaq, ehtiyat etmək. *Soyuq suda çimməkdən qorxur. Yağışa düşəcəyimdən qorxuram. Onunla üz-üzə gəlməkdən qorxuram. – Buğac inamlı səslə davam etdi: – Qorxma, anacan, mənə bu yaradan ölüm yoxdur.* M.Rzaquluzadə.

3. Bir şeyin təsirindən xarab olmaq, pozulmaq, korlanmaq. *Bu bitkilər soyuqdan qorxmur*.

**qorxa-qorxa** *zərf* Çox ehtiyatla, çəkinə-çəkinə. *Mən qorxa-qorxa kresloların birinin üstə oturub yumşaq məxmər döşəyin içinə .. qulaylandım*. C.Məmmədquluzadə. [Əhməd:] *Sən get qonşu arvadlardan bir-ikisinə qorxa-qorxa nəql elə ki, bəs bizim əncir ağacının dibində çıraq yanır*. Ə.Haqverdiyev. *Xidmətçilərin hamısı pəncələri üstə yeriyir, qorxa-qorxa pıçıltı ilə danışırdı*. M.İbrahimov.

**QORXMAMAZLIQ** bax **qorxmazlıq**. *Lakin bu qorxmamazlığa və cürətliliyə baxmayaraq, Baxış oğlu Həsən çox da şəriət qoyan qanundan çıxmaz və dinin yolunu azmazdı*. B.Talıblı.

**QORXMAZ** *sif.* Heç şeydən qorxmayan, çəkinməyən; ürəkli, qoçaq, cəsur, igid. *Nəhayət, bəlli oldu ki, qorxmaz uşaq tüfəng ilə o tərəflərdə gəzişirmiş*. A.Şaiq.

**QORXMAZLIQ** *is.* Heç şeydən qorxmama; cəsurluq, igidlik, qoçaqlıq, rəşadət, ürəklilik. *Əmirin üsuli-idarəsinə qarşı bir düşmən kimi hücum edən şair öz böyüklüyünü və qorxmazlığını ziyafətdə onların hamısına göstərdi.* M.S.Ordubadi.

**QORXU** *is.* 1. Gözlənilən və ya yaxınlaşan bir təhlükə qarşısında hasil olan həyəcan halı, dəhşət, təlaş hissi; hövl, xof. *Qorxu hissi. Ölüm qorxusu. Qorxudan əsmək. – Yazıq şair qorxudan övrət məsələsini fars və ərəb dilində danışır ki, Ordubad qırmızısaqqalları başa düşməsinlər ki, hay-küy salmasınlar*. C.Məmmədquluzadə. *Qapının səsi onu* [Xavəri] *gələcək qorxusu və çörək dərdinin doğurduğu iztirablardan ayırdı.* M.İbrahimov. *Qalmamış bu bizim azad diyarda; Nə zindan qorxusu, nə çörək dərdi*. S.Vurğun. // Həyəcan, iztirab, təşviş, təlaş. *Onların məsum gözlərindən qorxu süzülüb tökülürdü*. M.S.Ordubadi. *Şəmsiyyənin utandığından və qorxusundan bütün bədəninə soyuq bir tər gəldi*. M.İbrahimov. *İnsan qorxu deyil, qardaşlıq duyur; Körpələr beşikdə rahat uyuyur*. S.Vurğun. ☐ **Qorxuya düşmək** – təşvişə düşmək, həyəcana düşmək, qorxmaq. *..Atalarından bir xəbər çıxmadı. Xədicə bərk qorxuya düşmüşdü*. S.S.Axundov. *Katib .. bərk qorxuya düşdü, bir neçə vərəqə kağız çıxarıb qabağına qoydu*. S.Rəhimov. **Qorxuya salmaq** – təşvişə salmaq, qorxutmaq, həyəcana salmaq.

2. Təhlükə, fəlakət, qəza və başqa qorxulu hadisə ehtimalı. *Müharibə qorxusu. Bu gün yağış qorxusu vardır. Daşqın qorxusu azalmışdır. Quraqlıq qorxusu keçdi. – İndi yay günü Mil düzündə azan yolçunun susuzluqdan yanmaq qorxusu yoxdur.* İ.Əfəndiyev.

3. Ehtiyat. *Qorxum budur əsər qıla, ey şəh, bu ahlar*. S.Ə.Şirvani.

4. *Zərf mənasında*: **qorxudan**. *Qorxudan elə bağırdı ki. Qorxudan az qala ürəyi partladı*.

**QORXUBİLMƏZ** *sif.* Heç şeydən qorxmayan, çəkinməyən; çox ürəkli. *Qorxubilməz uşaq*.

**QORXUBİLMƏZLİK** *is.* Heç bir şeydən qorxmamazlıq, ürəklilik.

**QORXUDULMA** "Qorxudulmaq"dan *f.is.*

**QORXUDULMAQ** "Qorxmaq"dan *məch*.

**QORXU-HÜRKÜ** *is.* bax **qorxu** 2-ci mənada.

**QORXULU** *sif.* 1. Qorxunc, qorxu hissi doğuran; qorxu gətirən, qorxudan, dəhşətli. *Qorxulu nağıllar. Qorxulu yuxu.*

2. Təhlükəli, xətərli, xatalı. *Qorxulu yol. Qorxulu səfər. – Zəmanənin dəyişikliklərindən bixəbər işə başlamaq yolsuz və qorxulu bir çölə yönəlmək kimidir*. A.Bakıxanov. *Lakin məktubun başqa əllərə düşməsi olduqca qorxulu bir hadisədir.* M.S.Ordubadi. *Şəmsiyyə yalnız indi necə qorxulu bir addım atdığını duydu.* M.İbrahimov. // Pis nəticə verə bilən, ölümlə nəticələnə bilən. *Qorxulu xəstəlik.*

**QORXULUQ** *is.* 1. Təhlükə, qorxulu vəziyyət.

2. Quşları, heyvanları qorxutmaq üçün bostan və tarlada qoyulan uyuq. *Qorxuluq qoyulduqdan sonra, bir zaman bostanın yaxınlığına heç bir heyvan gəlmir.* Cəbrayılbəyli.

**QORXUNC** *sif.* 1. Dəhşət doğuran, qorxuya salan, vahiməyə salan, dəhşətli. *Qorxunc səs. – Dərə qərbə getdikcə qayalıq, dağlıq iri və oyuq daşlarla dolu qorxunc yerlərdən ibarətdi.* A.Şaiq. [Mehribanın] *dişləri kilidlənmiş, əl-ayağı quruyub əsdiyi halda, qorxunc və vəhşi bir səslə çığırırdı.* S.Hüseyn. *Sağımız dağ, solumuz qorxunc uçurum, meşəlik, dağlıqdır.* S.Rüstəm. // Çox güclü, çox şiddətli. *Sizi sarsıtmasın qorxunc, inadlı; Şimal göylərinin ayazı, qarı.* Ə.Cəmil.

2. Baxanda adamda dəhşət, vahimə hissi doğuran, görünüşü qorxulu. *Qorxunc görünüş. – Musa qarabənizli, ortayaşlı, ortaboylu, qorxunc simalı bir tipdir.* H.Cavid. *Uzun papağını bir kənara qoyan, başının tükləri qabaran Ələmdar diqqətlə öz qorxunc sifətinə baxmağa başladı.* S.Rəhimov. [Xanın] *yuxuda gördüyü qorxunc məxluqlar yadına düşdü.* M.Rzaquluzadə.

3. Qorxulu, təhlükəli, xətərli. *Mikrobların bir qismi zəhərli və hətta qorxuncdur. – Orxan indi qorxunc bir addım atır.* H.Cavid.

**QORXUSUZ** *sif.* və *zərf* 1. Qorxusu olmayan, qorxu bilməyən, qorxmaz, heç şeydən ehtiyat etməyən, qorxmayan, çəkinməyən. *Qorxusuz adam. Qorxusuz uşaq. – Şığıyıb şimşək kimi qayalar arasından; Qorxusuz keçib gedir qüdrətli dağ qartalı.* R.Rza.

2. Heç bir qorxusu, xətəri, ziyanı olmayan; təhlükəsiz, xətərsiz, zərərsiz. *Qorxusuz yol. Qorxusuz iş. Qorxusuz dərman.*

**QORXUSUZLUQ** *is.* 1. Qorxu bilməmə, heç şeydən qorxmama, çəkinməmə; cəsarət. [Qız] *məni özünün dalğınlığı, qorxusuzluğu ilə maraqlandırdı.* S.Hüseyn.

2. Təhlükəsizlik, əmin-amanlıq, əmniyyət.

**QORXUŞMAQ** *f.* Qorxmaq (çoxları), hamısı qorxmaq. *Çinovniklərdən hər biri bu sözlərin hədyan və başdan-ayağa yalan olduğunu anlayıb, bu hədyanatı eşitdikcə dəxi də artıq qorxuşurlar.* F.Köçərli.

**QORXUTMA** "Qorxutmaq"dan *f.is.*

**QORXUTMAQ** *f.* 1. Qorxmasına səbəb olmaq, qorxu vermək, xoflandırmaq, çəkindirmək. *Noldu qəmimə gətirmədin tab? Qorxutdu məgər səni bu girdab?* Füzuli. *Başında nişanə aldım almanı; Qorxutmadı hədəf, nişanə səni.* "Koroğlu". *..Kərbəlayı Cəfər bərk çığırıb, Məhəmməd Həsən əmini lap qorxutdu.* C.Məmmədquluzadə. // Təşvişə salmaq, canına qorxu salmaq.

2. Hədələyərək qorxuya salmaq, hədələmək. *Uşaqları qorxutmaq.* – [Heydər bəy:] *Onu birdən çıxdı, qorxutdum, hamısı qaçdı, getdi.* M.F.Axundzadə.

3. Hürküdüb qaçırmaq. *Toyuqları qorxudub qaçırmaq.*

**QORXUZMA** "Qorxuzmaq"dan *f.is.*

**QORXUZMAQ** *dan.* b a x **qorxutmaq**. *Ay çalağanlar, məni qorxuzmayın; Mən sizə tərk eyləmişəm lanəni!* M.Ə.Sabir. *Tənbəl anaları uşağı xortdandan qorxuzublar ki, səsini kəsib yatsın.* C.Məmmədquluzadə. *Bəlkə Həpir .. arvad-uşağı qorxuzmaq üçün qəzəblə gəlirdi?* Mir Cəlal.

**QORİLLA** [*xar.*] Qərbi Afrika meşələrində yaşayan ən iri, insanabənzər meymun. *Qorilla insanabənzər meymunların ən böyüyü olub, 180 sm və daha artıq hündürlüyə çatır.* "Zoologiya".

**QORLAMA** "Qorlamaq"dan *f.is.*

**QORLAMAQ** *f.* 1. Yanan odunu qor halına gətirmək, qora çevirmək.

2. Bişirilən bir şeyin üstünü qor ilə örtmək, qor ilə basdırmaq.

**QORLANDIRMAQ** b a x **qorlamaq** 1-ci mənada.

**QORLANMA** "Qorlanmaq"dan *f.is.*

**QORLANMAQ** 1. *t-siz.* Qor halına gəlmək, qora çevrilmək, yanıb qor olmaq, qoru tökülərək alovsuz yanmaq. *Odur, bax, meşənin içində hələ bir ocaq da qorlanır.* S.Rəhimov.

2. *məch.* Qor ilə basdırılmaq, qor ilə örtülmək.

3. *t-siz. məc.* Şikayətlənmək, yanıxmaq.

**QORLAŞMA** "Qorlaşmaq"dan *f.is.*

**QORLAŞMAQ** b a x **qorlanmaq** 1-ci mənada.

**QORLATMAQ** b a x **qorlamaq** 1-ci mənada.

**QORLU** *sif.* 1. İçində qor olan, qoru olan. *Qorlu küldə bişmiş kartof. Qorlu kösöv.*

2. *məc.* Sağalmamış, ağrıdıcı, göynəyən. *Bu sözdən elə bil Həsənin qorlu yarasının üstünə köz basdırıldı.* A.Şaiq.

**QORODNİ́Çİ** [*rus.* городни́чий] *tar.* b a x **qalabəyi**.

**QORODOVÓY** [*rus.*] *tar.* Çar Rusiyasında: aşağı rütbəli polis xidmətçisi, polis nəfəri. *Axırı lap naəlac qalıb getdim bir qorodovoy çağırdım, oğlanı döyə-döyə çıxartdı eşiyə.* C.Məmmədquluzadə. [Gülcahan:] *A kişi, yoxsa .. qorodovoydan qorxub özünü bu günə salırsan?* N.Vəzirov. *Pristav izn istəmədən içəri girib* [birbaşa] *yatağa yaxınlaşaraq, arxasınca gələn qorodovoyun birisinə buyurdu: – Döşəyi sök!..* H.Nəzərli.

**QORUQ** *is.* 1. Təbii-tarixi əhəmiyyəti olan bitki, heyvan və s. cinslərini qoruyub saxlamaq məqsədi ilə hökumət tərəfindən xüsusi mühafizə altına alınmış yer, meşə və s.

2. Əkilmiş yerlər (əkin, bostan, tarla, otlaq və s.). *..Cökə ağaclarının qoruqlarda, tarlalarda biçilmiş təzə otların gözəl ətri .. bir-birinə qarışaraq obaya başqa bir rəng, başqa bir şəkil verirdi.* A.Şaiq. *İlxı qoruqdan qayıdırdı.* İ.Əfəndiyev.

3. Keçmişdə: istifadə edilməsi qadağan olunmuş mülkədar yerləri. *Canım, mən də qaçıram. Arığın nə işi var qoruqda, vuralar qılçası sına.* N.Vəzirov. [Gülsənəm:] *Guya qızıl inək ağanın qoruğuna girmiş.* S.S.Axundov.

4. Qarovul, keşik. [Bədirnisə] *ərinin qoruqdan qayıtmasını gözləmədi; qapının ağzına bir qıfıl vurub, ispolkomun idarəsinə getdi.* Mir Cəlal.

◊ **Qoruq olmaq** – qadağan olmaq, yasaq olmaq. *İlyas bu gün meşənin qoruq olduğunu bilmirdi.* M.S.Ordubadi.

**QORUQÇU** *is.* Əkin, tarla, meşə, bostan və s. qarovulçusu; gözətçi, mühafizəçi. [Qəmər:] *Baba, təzə qoruqçunu aparım, bostana buraxım.* S.S.Axundov. *Barxudarın yaxşı işlərindən danışılan sözlər qoruqçu Ağanın arvadı Bədirnisənin qulağına çatdı.* Mir Cəlal.

**QORUQÇULUQ** *is.* Qoruqçu vəzifəsi, qoruqçunun peşəsi, işi.

**QORUQ-QAYTAQ** *is. dan.* Hədd-hüdud, çərçivə, ədəb dairəsi, nəzakət.

**QORUQ-QAYTAQSIZ** *sif.* və *zərf* Hədd-hüdud bilməyən, danışığını, hərəkətini bilməyən; ədəbsiz, nəzakətsiz. *O, qızışdığı vaxt .. qoruq-qaytaqsız danışırdı.* Ə.Əbülhəsən.

**QORUMA** "Qorumaq"dan *f.is.*

**QORUMAQ** *f.* 1. Hücumdan, təhlükədən, zərbədən, düşməncə qəsdlərdən və s.-dən mühafizə etmək, müdafiə etmək, təhlükəsizliyini təmin etmək. *Vətəni qorumaq. Ölkənin hüdudlarını qorumaq.* – [Yasavulbaşı] .. *tez-tez atını sürüb oğlu ilə* [atanın] *arasına girir, guya özünü sipər edib onu oğlundan qoruyurdu.* M.Rzaquluzadə.

2. Pis, zərərli və ya istənilməz bir şeyin təsirindən mühafizə etmək. *Xəstəliklərdən qorumaq. Başını gündən qoru! Uşağı soyuqdan qorumalı. Quşları sevmək, onları qorumaq hər bir məktəblinin borcudur.* // Ümumiyyətlə, mühafizə edib saxlamaq. [Səriyyə xala] *uşaqların gələcəyini düşünərək yaxasında gizlətdiyi .. pulu bir sirr kimi qorumağı qərara aldı.* M.İbrahimov.

**QORUNMA** "Qorunmaq"dan *f.is.* *Qorunma tədbirləri.*

**QORUNMAQ** 1. *qayıd.* Hücumdan, zərbədən və s.-dən özünü qorumaq, özünü müdafiə etmək. *Düşməndən qorunmaq.* // Özünü gözləmək, özünü mühafizə etmək, saxlamaq. *Qripdən qorunmaq. Yağışdan qorunmaq.*

2. "Qorumaq"dan *məch.*

**QORUT** b a x **qovut**. *..Dumada danışmaq niyə lazımdı? O qədər orada çərən-pərən danışan var ki, heç ağızlarına qorut verən yoxdur.* "Mol. Nəsr."

**QORUYUCU** *sif.* Bir şeydən qoruyan, bir şeyin qabağını alan, saxlayan, mühafizə edən. *Qoruyucu tədbirlər. Qripdən qoruyucu dərmanlar. Qoruyucu gözlük. Seldən qoruyucu sədlər. Qoruyucu meşə zolaqları.* // *is.* Qoruyan mexanizm, cihaz, qurğu və s.

**QOŞA** 1. *sif.* Cüt, iki dənə, bir cüt. *Qoşa qala qapısı. Qoşa buynuz. Qoşa tir.* // Yan-yana duran. *Hətəm qoşa qarağacın dibinə düşən kölgəyə baxırdı.* Ə.Əbülhəsən.

2. *zərf* İkisi bir yerdə, ikisi yan-yana; birgə, bərabər, birlikdə, bir yerdə. *Biz oraya qoşa getdik. – Rüxsarə heç bir vəchlə Rizvanla*

*Tamaranın qoşa gəzmək xəbərini ürəyinə sığışdıra bilmirdi.* S.Rəhimov.

3. *say.* İki. *Qoşa qardaş. Qoşa bacı. – Yavaş-yavaş bölmələrin qoşa adamlıq səngərləri ümumi bir əlaqə yolu ilə birləşməyə başlayırdı.* Ə.Əbülhəsən. // Əkiz, bir yerdə doğulmuş.

**qoşa-qoşa** *zərf* Cüt-cüt, iki-iki. *Qoşa-qoşa gəzmək. Qoşa-qoşa durmaq. – Gülbala və Abdal aşıqları sədəfə tutulmuş sazlarını dınqıldadaraq qoşa-qoşa kallayının bu başından o başına gedir, gah durub bayatı deyir, gah süzürdülər*. Çəmənzəminli.

**QOŞAATLI** *sif.* Bir cüt at qoşulmuş, ikiatlı. *Qoşaatlı fayton*.

**QOŞABUTA** *is.* Qoşa butalar şəklində olan naxış. *Qabların hamısı həndəsi və nəbati naxışlarla bəzənərdi. Onların üzərində ən çox üçbucaq, gül, qoşabuta və müxtəlif xətlərdən düzəldilmiş naxışlara təsadüf edilir*. Tərlanov.

**QOŞABUYNUZ(LU)** *sif.* Cütbuynuzlu, cüt buynuzu olan. *Qoşabuynuzlu öküz. – Qoşabuynuz bu keçi; O sayılır fermada; Qoyunların erkəci*. M.Dilbazi.

**QOŞACİBLİ** *sif.* Qoşa cibi olan, paltarının hər iki tərəfində cibi olan. *Dilman .. həmişə qoşacibli frenç geyməyi sevən ucaboylu bir adamdı.* M.Hüseyn.

**QOŞADIRNAQLI** *sif. zool.* Qoşa dırnağı olan.

**QOŞADIRNAQLILAR** *cəm zool.* Eyni dərəcədə inkişaf etmiş qoşa dırnağı olan məməli heyvanlar dəstəsi.

**QOŞADODAQ** *sif.* Üst dodağı yarıq olan (dəvə, dovşan və b.k. heyvanlar haqqında).

**QOŞAGÖRƏN** *sif. dan.* Çaş, çəpgöz, bir şeyi iki görən.

**QOŞAGÖRMƏ** *is. dan*. Çaşlıq, çəpgözlük; bir şeyi iki görməkdən ibarət göz nöqsanı.

**QOŞAQ** *zərf* Qoşa halda, ikisi bir yerdə olduğu halda, birgə.

**QOŞAQANAD(LI)** *sif.* 1. Cüt qanadı olan, iki qanadı olan. *Qoşaqanadlı təyyarə*.

2. İki taydan ibarət olan. *Qoşaqanad qapı.*

**QOŞALAMA** "Qoşalamaq"dan *f.is.*

**QOŞALAMAQ** *f.* 1. İkiləmək, iki eləmək.

2. Cüt qoymaq, iki şeyi yan-yana qoymaq, cütləşdirmək. *..Zeyğəm isə əllərini qoşalayıb çırtıq çalırdı*. S.Rəhimov.

3. *ovç*. Yerə qonmuş və ya uçan quşları nişana alaraq ikisini bir atımda vurmaq.

**QOŞALANMAQ** bax **qoşalaşmaq**.

**QOŞALAŞDIRILMA** "Qoşalaşdırılmaq"-dan *f.is.*

**QOŞALAŞDIRILMAQ** *məch.* Qoşa edilmək, cüt edilmək; ikiləşdirilmək, cütləşdirilmək.

**QOŞALAŞDIRMA** "Qoşalaşdırmaq"dan *f.is.*

**QOŞALAŞDIRMAQ** *f.* Qoşa etmək, cüt etmək; ikiləşdirmək, cütləşdirmək; cüt-cüt etmək, cüt-cüt qoymaq. // bax **qoşalamaq** 2-ci mənada. *Zabit heç söz demədi, ancaq bir əsgər kimi hərbi vəziyyət aldı və ayaqlarını qoşalaşdıraraq dönüb getdi.* M.S.Ordubadi. [Nəriman] *şəhadət barmağını bir-birinə qoşalaşdırıb yan-yana yazılan kəlmələri göstərdi.* Mir Cəlal. [Nənəqız] *Rizvanı və Rüxsarəni gözləri qabağında qoşalaşdırır, xəyalında gələcək gözəl nəvələri ilə indidən öyünürdü.* S.Rəhimov.

**QOŞALAŞMA** "Qoşalaşmaq"dan *f.is.*

**QOŞALAŞMAQ** *f.* Qoşa olmaq, cüt olmaq; cütləşmək, ikiləşmək. // Bir-birinə yanaşı olmaq, bir-birinin yanında durmaq. *İki yoldaş qoşalaşıb gedirlər*.

**QOŞALATMA** "Qoşalatmaq"dan *f.is.*

**QOŞALATMAQ** *icb.* 1. Bir şeyi ikiləşdirtmək, cütləşdirtmək, qoşa və taylı etdirmək.

2. Yan-yana qoydurmaq, bir-birinə yanaşdırmaq.

**QOŞALÜLƏ** *is.* İki lüləsi olan tüfəng, ya tapança. [Qəmər:] *Piri baba meşəyə girdikdə qarşımıza dovşan çıxdı. Bunu gördükdə Şəmsi bəy nəzakətlə qoşalüləsini çiynindən çıxar*(*dı*).. S.S.Axundov. *O, maşının dayanmasını gözləyib, qoşalülənin tətiyini geriyə çəkdi.* M.Hüseyn. // *sif.* İki lüləsi olan. *Qoşalülə tüfəng*.

**QOŞASƏSLİ** *sif. dilç*. Yan-yana iki səsli olan. *Qoşasəsli söz.*

**QOŞAŞDIRMAQ** *f.* Qoşa çapmaq, qaçışdırmaq, yarışdırmaq (atları). [İsrafil] *yaşlı və təcrübəli minicilərlə at qoşaşdırmağı belə bacarırdı.* M.Hüseyn.

**QOŞAŞMAQ** *f.* Qoşa yüyürmək, qaçışmaq, yarışmaq.

**QOŞAYARPAQ** *is.* 1. Bitkinin yenicə göyərərək qoşa yarpaq açması. ☐ **Qoşayarpaq olmaq** – yenicə göyərmək, cücərmək, ilk qoşa yarpağı görünmək. *Pambıq qoşayarpaq olanda becərmə işləri qızğın gedirdi*. Ə.Vəliyev.

2. *folk*. İki misradan ibarət xalq şeri forması.

**QOŞAYELƏN** *sif. məh*. Qoşa haşiyəli, cüthaşiyəli. *Başına altdan balaca ipək dəsmal örtdü, sonra qoşayelən qara ipək kəlağayını bağladı.* Ə.Vəliyev.

**QOŞAYELKƏN(Lİ)** *sif.* İki yelkəni olan, cütyelkənli. *Qoşayelkənli qayıq*.

**QOŞDURMA** "Qoşdurmaq"dan *f.is.*

**QOŞDURMAQ** "Qoşmaq"dan *icb. Öküzləri kotana qoşdurmaq*. *Atları arabaya qoşdurmaq. Vaqonları parovoza qoşdurmaq*. – [Şəmsi bəy:] *Ana, siz də hazır olun, mən də gedim faytonu qoşdurum*. S.S.Axundov.

**QOŞDURULMA** "Qoşdurulmaq"dan *f.is.*

**QOŞDURULMAQ** "Qoşdurmaq"dan *məch*.

**QOŞQU** *is.* Arabaya və s.-yə qoşulan at və başqa heyvan. *Minik atından da artıq qoşqu atını mən xeyli dost tutaram.* C.Məmmədquluzadə. ☐ **Qoşqu qüvvəsi (heyvanı)** – arabaya və s.-yə qoşulan at və s. heyvan. *Nəqliyyat və kənd təsərrüfat işlərinin geniş miqyasda mexanikləşdirilməsinə baxmayaraq, xalq təsərrüfatında canlı qoşqu qüvvəsinin, xüsusən, atın rolu mühüm olaraq qalmaqdadır.* Səttarzadə. **Qoşqu ləvazimatı** – atlar və ya başqa heyvanları arabaya və s.-yə qoşmaq üçün gərək olan ləvazimat.

**QOŞQULANMA** "Qoşqulanmaq"dan *f.is.*

**QOŞQULANMAQ** *f.* Qorxub hürkmək, narahat olmaq, təşvişə düşmək, qorxudan titrəmək. *Köpək də dərənin dibindən keçən dəvə karvanın zəng səslərini dinləyə-dinləyə qoşqulanır.* M.S.Ordubadi.

**QOŞMA**[1] 1. "Qoşmaq"dan *f.is.*

2. *sif.* Qoşulan, özü hərəkət edə bilməyən. *Qoşma inventar. Qoşma vərdənələri traktor yedəkləyir.*

3. *sif.* Bir-birinə qoşulan, bağlanan, birləşdirilən.

**QOŞMA**[2] *is. qram*. Müstəqil mənası olmayıb, nitq hissələrindən sonra gəlib müxtəlif münasibət bildirən köməkçi söz; məs.: görə, ötrü, başqa.

**QOŞMA**[3] *is. ədəb*. Hər bəndi dörd misradan ibarət lirik şeir forması. *Vaqifin qoşmaları. Aşıq Ələsgərin qoşmaları. – Mən səni görmüşəm on beş il əzəl; Dilində bir qoşma, bir dərdli qəzəl.* S.Vurğun.

**QOŞMAQ**[1] *f.* 1. Arabanı və s.-ni çəkib aparmaq üçün atı və başqa qoşqu heyvanlarını xüsusi surətdə arabaya və s.-yə bağlamaq. *Öküzləri kotana qoşmaq. Arabaya dörd at qoşdular. Şimalda kirşəyə it və ya maral qoşurlar.* – [Faytonçu:] *Sənin xatirin üçün qırx yeddi manata qoşaram*. Ə.Haqverdiyev. *Payızın əvvəlindən Nurəddin arabasını qoşub, şəhərə kirayəçiliyə getdi.* S.S.Axundov.

2. İlişdirmək, bənd etmək, bağlamaq. *Qatara əlavə vaqon qoşmaq. Vaqonları parovoza qoşmaq. Kotanı traktora qoşmaq*.

3. Birləşdirmək, qatmaq. *Mən də qoşdum səsimi; Bu gəncliyin səsinə*. Ə.Cavad.

4. Cəlb etmək, bir işin iştirakçısı etmək. *Siz varlı kolxozları bu işə qoşun! Qoyun kəndimiz şəhərə çatsın!* S.Rəhimov.

5. Birgə, bərabər göndərmək, yanınca göndərmək, yoldaş etmək. *O, Süleyman adlı bir nəfəri bizə qoşdu*. M.S.Ordubadi. [Səfi bəy:] *Buyurun gedək, adam qoşum, sizi xalanızgilə aparsınlar*. S.S.Axundov. *Bakıda Firidunu növbəti çağırışçılara qoşub Tbilisiyə göndərdilər.* Mir Cəlal.

6. Düzəltmək, təlif etmək, demək. *Mahnı qoşmaq. Dastan qoşmaq*. – [Hacı Rəsul:] *Deyəsən bu sözləri lap mənə qoşublar. Vallah, mənim halıma qoşublar: hara qədəm basdım, xəzan oldu.* Mir Cəlal. *El aşıqları incə Azərbaycan dilində xalqımızın mərdliklərini tərənnüm edən ölməz dastanlar qoşurdular*. İ.Əfəndiyev.

**QOŞMAQ**[2] *f.* Getmək, bir tərəfə üz tutmaq, yüyürüb getmək. *Vaxta ki bu izdihamı gördüm; Mən də o yerə qoşub yüyürdüm.* M.Ə.Sabir. *Kənd uşaqları əllərində badya, mis kasa dərəyə doğru qoşurdular*. A.Şaiq. *Azacıq keçmədən cəsur insanlar; Qoşdu iş başına, tərpəndi şəhər.* S.Vurğun.

**QOŞULAN** *f.sif.* Özü hərəkət edə bilməyən, başqası ilə birləşdirilən; motorsuz.

*Qoşulan tramvay vaqonu* (motorlu vaqona qoşulan motorsuz vaqon).

**QOŞULMA** "Qoşulmaq"dan *f.is.*

**QOŞULMAQ** *f.* 1. "Qoşmaq"dan *məch. Atlar arabaya qoşulmuşdur. Fayton qoşulmuşdur. Vaqonlar parovoza qoşuldu.*

2. *t-siz*. Birləşmək, qarışmaq, daxil olmaq, bir işin iştirakçısı olmaq. *Fəhlələrin daha düzgün fənd işlətdiklərini görən yanğın alayı da onlara qoşuldu*. M.Hüseyn. *Payızda* [Şamama] *da anasına qoşulub pambıq yığırdı*. İ.Əfəndiyev. // Şərik olmaq, razı olmaq, qəbul etmək. *Yoldaş sədr, cavanlar deyənə mən də qoşulub qol qoya bilərəmmi?* Mir Cəlal.

3. *t-siz*. Yoldaş olmaq, birləşmək, əlaqə saxlamaq. [Məsmə*:*] *Xəstəxanaya getməyə ürəyim gəlmirdi. Nəhayət, bir gün tanış bir qadına qoşulub oraya getdim.* S.Hüseyn.

4. Məşğul olmağa başlamaq, pis iş dalınca getmək. [Naçalnik*:*] *Sən mənim məsləhətimi eşitməyib, yenə yaman işə qoşuldun.* M.F.Axundzadə.

5. *t-siz*. Qarışmaq, müdaxilə etmək. [Məşədi Qurban:] *Sənlik nə var ki, bu işə qoşulursan? Sən nəçisən?* M.F.Axundzadə. *O, heç özünün də xəbəri olmadan söhbətə qoşulmuşdu*. Ə.Əbülhəsən.

◊ **Qoşulub qaçmaq (getmək)** – köhnə məişətdə: ata-anasının razılığı və xəbəri olmadan, qızın sevdiyi oğlanın evinə getməsi. [Sona xanım:] *Mən toy istəmirəm. Elə toysuz gedəcəyəm. Qoşulub qaçan .. bir mən deyiləm; gündə yüzü qoşulub qaçır.* M.F.Axundzadə. *Gülpərinin könlü əmisi oğlunda idi. Ona görə ona qoşulub qaçmaq istəyirdi.* S.S.Axundov. [Məhərrəm:] *Mən sənin yerinə olsam, Cahangir, əhvalatı düz Rüstəm bəyin özünə deyərəm və qandıraram ki, qızın Rəşid bəyi doğrayan Heydər bəyin oğluna qoşulub qaçmaq istəyir, onda bəlkə...* N.Vəzirov.

**QOŞUN** *is*. Bir dövlətin nizami hərbi qüvvələri və ya onların bir hissəsi. *Piyada qoşun. Nizami qoşun. Qarışqanın sayı var idi, qoşunun sayı yox idi. – Qalanın hər yanını qoşunlar bürümüşdü*. M.Hüseyn. [Quldurbaşı] *möhkəm tapşırdı ki, qoşunun başında gələcək Qazanxana və bəylərə müqavimət göstərməyib buraxsınlar.* M.Rzaquluzadə. // *məc.* Çoxluq, izdiham mənasında.

◊ **Qoşun çəkmək** – hücum etmək, müharibəyə başlamaq. *Surxay xan da hər məqamda Koroğlunun üstünə qoşun çəkərdi ki, qardaşının qanını alsın, amma igid Koroğluya bata bilməzdi*. (Nağıl).

**QOŞUNKEŞDİ** *is.* Dava, döyüş, vuruş. [Arvad:] *Vay, vay, vay! A kişi, bu nə üstbaşdır, bu nə əl-ayaqdır .. qoşunkeşdidən, davadan gəlirsən nədir?* H.Sarabski.

**QOŞUNKEŞLİK** *is. köhn*. Qoşun toplama, səfərbərlik, bir ölkəyə qarşı müharibəyə hazırlaşma; hərbi səfər, hərbi yürüş. [Fəxrəddin bəy:] *Qoşunkeşlikdə elə dolanmazlar ki, biz bu neçə gündür dolanırıq*. N.Vəzirov. [Vaqif:] *Bu qədər qoşunkeşlik həm xanın xəzinəsinə ziyandır, həm də el və obaya*. Çəmənzəminli. □ **Qoşunkeşlik eləmək (etmək)** – qoşun çəkib dava eləmək; ümumiyyətlə dava eləmək, dava axtarmaq, vuruşmaq istəmək. *Mir Cümə irəliləyərək Əli dayıya dedi: – Balam, sən ki qoşunkeşlik eləyirsən.* P.Makulu.

**QOŞUŞMA** "Qoşuşmaq"dan *f.is.*

**QOŞUŞMAQ** *qarş*. Bir yerdə, hamı birdən qoşmaq, getmək, yönəlmək, yüyürüşmək.

**QOTAZ** *is.* Üst tərəfi bir yerə qısılıb bağlanmış saplardan ibarət saçaqlı bəzək. *Mirzə Süleyman bəy qırmızı fəsi qaşlarının üstə çəkib, qotazını qabaqdan sallayıb, .. sağ əlində ağacını firlada-firlada gəlir*. B.Talıblı. *Adət üzrə faytonçular atların boynuna bəzəkli qotazlar asmış, onları bəzəmişdilər.* M.İbrahimov. // Bu şəkildə olan şey. *Səfər, doğrudan da, qızların xoşuna gələnlərdən deyildi. Fəqət başıaşağı, bir oğlandı, .. birçəklərini qotaz daramazdı, qaməti də mövzun deyildi*. Ə.Haqverdiyev.

**QOTAZLAMA** "Qotazlamaq"dan *f.is.*

**QOTAZLAMAQ** *f.* Qotaz kimi etmək, qotaz tərzində toxumaq, qotaz kimi yumrulatmaq, qotaz bağlamaq.

**QOTAZLANMA** "Qotazlanmaq"dan *f.is.*

**QOTAZLANMAQ** *məch.* Qotaz bağlanmaq, qotazla bəzədilmək.

**QOTAZLANMIŞ** *f.sif.* Qotaz kimi olmuş; açmış. *Yaşıl kolların üstündə qotazlanmış ağ pambıqlar gendən adamı çağırırdı.*

**QOTAZLAŞMAQ** *f.* Qotaz kimi olmaq, qotaz halına gəlmək; açmaq.

**QOTAZLI** *sif.* Qotazı olan, qotaz bağlanmış, qotazla bəzənmiş. *Qotazlı pərdə. Qotazlı bayraq. Qotazlı qaytan*. – [Məşədi Məmməd] *əlində başı qotazlı təsbehini çevirərək baqqal Əbdülhəsənin dükanına gəldi*. B.Talıblı. *Xanım qara, ağır və qotazlı, piləkli pərdələri saldı*. Mir Cəlal. *Onun başının üstündən divarda .. qotazlı bir qılınc, qalxan, yay və sadaq asılmışdı*. M.Rzaquluzadə.

**QOTAZLIQ** *is.* Qotaz üçün yarar.

**QOTİ́K** *sif.* [*xüs. is.*-dən] Qotikaya aid olan; qotikaya xas olan, qotika üslubunda olan. *Qotik üslub. Qotik ornament.* ☐ **Qotik hürufat, qotik hərflər, qotik yazı** – xətləri sınıq, tin-tin şəkildə olan hərflər, yazılar (Almaniya və bəzi başqa ölkələrdə işlənir).

**QÓTİKA** [*xüs. is.*-dən] Qərbi Avropanın orta əsr memarlığında: çatma tağ və qübbələri, çoxlu daş oymaları və bəzəkləri, həmçinin yuxarı qalxdıqca incələşən arxitektura formaları ilə fərqlənən memarlıq üslubu. *Beşbarmaq dağının qotik binalara oxşayan çılpaq qayaları saf, zümrüd göylərə doğru ucalırdı*. Mir Cəlal.

**QOTLAR** *cəm tar*. Qədim alman tayfalarından biri. *III əsrdə Qara dəniz sahillərinin cənub çöllərindəki tayfalar yenidən birləşdilər, bu tayfalar* "*qotlar*" *adı ilə məşhur idilər*.

**QOTMAN** *is.* Tayaya vurulmaq üçün koma şəklində yığılmış ot. *Biçilmiş otlar qotmanlara vuruldu. Otu tirələrdə kiçik qotmanlarda qurutmaq daha yaxşıdır. – Sonra yumşaq otların, qotmanların üstündə atılıb-düşməyə, bağırışmağa başladıq.* A.Şaiq. [Arvadlar] *çoxdan quruyub qotmanlarda qalan otu tayalayırdılar.* Ə.Əbülhəsən.

**QOTMANLAMA** "Qotmanlamaq"dan *f.is.*

**QOTMANLAMAQ** *f.* Qotman şəklində yığmaq, qotman vurmaq. *Otu qotmanlamaq*.

**QOTMANLANMA** "Qotmanlanmaq"dan *f.is.*

**QOTMANLANMAQ** *məch.* Qotman şəklində yığılmaq, qotman vurulmaq.

**QOTMANVURAN** *sif. k.t.* Qotman halında yığan, komalayan. *Qotmanvuran maşınlar*.

**QOTUR** 1. *is.* Heyvanlarda və bəzən insanlarda yoluxucu dəri xəstəliyi (bu xəstəlikdə dəridə xırda səpmə əmələ gəlir və çox şiddətli qaşınma olur).

2. *sif.* Qotur xəstəliyinə tutulmuş; qoturlu, qoturu olan. *Qotur keçi. Qotur it.* // Söyüş mənasında. [Namaz:] *Daha burada bir* "*necə*" *yeri yoxdur. Sən deyəndə bir qotur kəndlinin biri idin.* Ə.Haqverdiyev.

**QOTURLAMA** "Qoturlamaq"dan *f.is.*

**QOTURLAMAQ** *f.* 1. Qotur olmaq, qotur xəstəliyinə tutulmaq.

2. *məc. dan*. Əldən düşmək, düşkünləşmək, acınacaqlı bir hala düşmək; pisləşmək, xarablaşmaq.

**QOTURLANMA** "Qoturlanmaq"dan *f.is.*

**QOTURLANMAQ** b a x **qoturlamaq**.

**QOTURLAŞMA** "Qoturlaşmaq"dan *f.is.*

**QOTURLAŞMAQ** b a x **qoturlamaq**.

**QOTURLUQ** *is.* 1. B a x **qotur** 1-ci mənada. *Heyvanlarda qoturluqla mübarizə.*

2. Qotur olma, qotur düşmə; qotur düşmüş heyvanın (adamın) halı.

**QOV** *is.* Bəzi ağaclarda ur kimi çıxan və xüsusi üsulla qurudulub hazırlandıqdan sonra, polad parçasının çaxmaq daşına çaxılmasından hasil olan qığılcımdan alışan pambığaoxşar yumşaq maddə. *Qasım kişi çaxmağı daşa vurub qovu yandırır, basır çubuğa*. C.Məmmədquluzadə. [Baba] *qovu çaxmaq daşı ilə alışdırıb çubuğu yandırdı*. Çəmənzəminli. *Qazma dama girib, çaxmaq çaxıb qov alışdırdı*. M.Rzaquluzadə.

**QOVAQ**[1] *is. bot.* Söyüd fəsiləsindən müxtəlif növləri olan qollu-budaqlı ağac. *Kürün o tayında, hündür qovaqların seyrəlib yulğunluğun başladığı yerdə beş-altı qaraltı görünürdü.* İ.Şıxlı.

**QOVAQ**[2] *is.* Heyvan tüklərinin arasında olan kəpək, qabıq.

**QOVAQLIQ** *is.* Çoxlu qovaq bitən yer, qovaq meşəsi.

**QOVALAMAQ** b a x **qovmaq**. *Bəzən çayda daşlar daşı qovalar; Seldə gedər göy çəmənlər, ovalar*. R.Rza. *Tazılar dovşanları qovalayır, nökərlər hay-küylə at çapırdılar.* M.Rzaquluzadə. *Məcid ilə Zeynəb məsələsinə gəldikdə* [Nadirin] *ürəyi döyünürdü, fikrini tez qovalayır və işin bu dərəcəyə gəlib çatmağına güman etməyirdi*. B.Talıblı.

**QOVALANMAQ** "Qovalamaq"dan *məch.* b a x **qovulmaq**.

**QOVAN** *is.* Arı yuvası, arı pətəyi. *Ümumi bir səs klubun həyatini də basmışdı. Arı qovanından çıxan kimi bir səs ucalırdı.* Mir Cəlal.

**QOVARLANMAQ** *f.* Öyünmək, kibr satmaq, qürrələnmək. *Ya mən ölməliyəm, ya siz, deyirdi; Cəlal qovarlanıb nəşə yeyirdi.* S.Vurğun.

**QOVDURMA** "Qovdurmaq"dan *f.is.*

**QOVDURMAQ** "Qovmaq"dan *icb.*

**QOVDURULMAQ** "Qovdurmaq"dan *məch.*

**QOVĞA** *is.* 1. Gurultu, patıltı, çaxnaşma. *..Əsədin bütün kəndə qovğa saldığına və bununla bərabər öz günahını yenə də düşünməməyinə acınıb* [müəllim] *dodaqlarını çeynəyərək, şəhadət barmağını ona tərəf silkələyib hədələdi.* B.Talıblı. // Dava, davadalaş, tutuşma, vuruşma, dalaşma, qalmaqal. *Aləmə şuriş salıbdır, fitnəyə, qovğayə bax.* Heyran xanım. *Gün batdı, hər kəs öz evinə və mənzilinə qayıtdı. Şuriş və qovğa sakit oldu.* M.F.Axundzadə. *İki qardaş arasında olan didişmələr get-gedə uzandı; axırda bir qovğa şəklini aldı.* A.Şaiq.

2. Bəla, müsibət; macəra, hadisə. *Bu müşəxxəsdi ki, eşq aşiqə qovğa gətirir.* X.Natəvan. [Üçüncü şirazlı:] *Bir belə bəlalara düçar olan, başı qovğalar çəkən, əlbəttə, gərək intiqam fikrini başından çıxarmaya.* Ə.Haqverdiyev. [Camal bəy:] *..Mərd kişinin başı qovğada gərək, deyərlər.* N.Vəzirov.

**QOVĞAÇI** *is.* Qalmaqalçı, davakar. *Həmişə dava salan adam.*

**QOVĞAÇILIQ** *is.* Qalmaqal, dava salmaq xasiyyəti.

**QOVĞALI** *sif.* 1. Davalı, qalmaqallı, cəncəl, mübahisəli. *Qovğalı iş. Qovğalı məsələ.*

2. Bəlalı. *Onun başı qovğalıdır.*

**QOVL** b a x **qövl**.

**QOVLAMA** "Qovlamaq"dan *f.is.*

**QOVLAMAQ** b a x **qovmaq**. *Bulaq üstə gələn arvad hər əlinə bir daş alıb, başladı Kərbəlayı Məhəmmədəlini qovlaya-qovlaya* (z.) *söyməyə.* C.Məmmədquluzadə.

**QOVLANMA** "Qovlanmaq"dan *f.is.*

**QOVLANMAQ** b a x **qovulmaq**.

**QOVLUQ** *is.* İçərisinə kağız, kitab və s. qoymaq üçün qalın cildli məhfəzə; papka. *Kağız qovluğu. – Mədəd iş qovluqlarından birisini açaraq nəzərdən .. keçirdi və qapayıb kənara qoydu.* Ə.Vəliyev. *Kapitan seyfi açıb oradan bir qovluq çıxartdı.* Ə.Əbülhəsən. // İçinə şey qoyulmaq üçün kağızdan hazırlanan qab. *Satıcı düyünü qovluğa töküb mənə verdi.* // İçərisində sap, iynə, oymaq və s. tikiş ləvazimatı saxlamaq üçün parçadan tikilmiş düyünçə. *Qovluqdan iynə-sap çıxartdı.*

**QOVM** b a x **qövm**.

**QOVMA** "Qovmaq"dan *f.is.*

**QOVMAQ** *f.* 1. Çıxıb getməyə, rədd olmağa məcbur etmək; çıxıb getməsini, rədd olmasını qaba surətdə əmr etmək. *Yazıq Hacı Mirzə Həsən ağa, niyə səni qatır üstə mindirib Təbrizdən çıxardıb qovdular?* C.Məmmədquluzadə. *Kişi məni evdən qovsa, bir gün də dolanmağa taqətim yoxdur.* N.Vəzirov. // *dan.* Çıxarmaq, xaric etmək. *İşdən qovmaq. İnstitutdan qovmaq.*

2. Bir şeylə, yaxud əl ilə uzaqlaşdırmaq, rədd etmək, çıxarmaq; çıxmağa, dağılışıb getməyə məcbur etmək. *Milçəkləri qovmaq. İtləri qovmaq. – Zeynəb gah çiçək yığırdı və gah da qışqıra-qışqıra pərvanələri qovurdu.* S.S.Axundov. *Əlimdəki dəyənəyimlə iti vura-vura qovdum.* A.Şaiq.

3. *məc.* Qəbul etməmək, geri qaytarmaq, rədd etmək. *Gələn qonağı qovmazlar.*

4. *məc.* Fikrindən, xəyalından çıxarmaq, uzaqlaşdırmaq. *Pis fikirləri qov getsin.*

5. Birinin arxasınca qaçmaq, izləmək, qaçıb getməyə məcbur etmək. *Ovu qovmaq. Dovşanı qovmaq. Oğrunu evinəcən qovarlar. – Qəmər arvad kişilərlə bərabər səngərə girib, quldurları gülləyə basmış, əri ilə bir yerdə atları Araza qədər qovmuşdu.* Ə.Vəliyev.

6. Vurmaqla, ya səs çıxarmaqla heyvanı iti getməyə məcbur etmək. *Atı dördayaq qovmaq.*

7. Öz yerindən hərəkət etməyə, bir tərəfə getməyə, qaçmağa məcbur etmək. *Qazları həyətə qovmaq. – Günəş yaxın dağlar ucundan doğar; Dumanları dağlara doğru qovar.* A.Şaiq. *Arvad-uşaq ağacların dibini və çuxurları doldurmuş payız küləyinin o tərəf-bu tərəfə qovduğu xəzəli çuvallara yığırdı.* M.İbrahimov.

**QOVOTU** *is. bot. məh.* Yamaclarda və çəmənlərdə bitən ot bitkisi.

**QOVRAQ** b a x **qıvraq**.

**QOVRAQLAŞMA** "Qovraqlaşmaq"dan *f.is.*

**QOVRAQLAŞMAQ** b a x **qıvraqlaşmaq**.

**QOVRAQLIQ** b a x **qıvraqlıq**.

**QOVRULMA** "Qovrulmaq"dan *f.is.*

**QOVRULMAQ** *f.* 1. Susuz olaraq yalxı və ya yağda od üstündə bişib qızarmaq. [Xudayar bəy:] *Ət bir tikə də yanmayıb, bəlkə qovrulubdu. Ətin çox yaxşı qoxusu gəlir.* C.Məmmədquluzadə.

2. *məc.* Yanmaq. *Gündə qovrulmaq. – ..Yaz ki, mən Əzim oğlu Qədim pambığıma su istəyirəm, torpağım qovrulur.* S.Rəhimov. *Gün altında qovrulan böyük, quru çöldə təndirdən qalxan kimi ağır və isti hava insanın vücudunu bürüyürdü.* Mir Cəlal.

3. *məc.* Əzab çəkmək, acıq çəkmək, iztirab və işgəncə içində olmaq (bəzən "qovrulub-yanmaq" şəklində işlənir). *O bütün gecəni acığından qovrulurdu. Həsrətdən qovrulmaq. – Sanki mən bədbəxt bu düşüncələr və bu kədərlərin içində qovrulmaq üçün doğuldum.* M.S.Ordubadi. *Fəridə bütün gecəni qovrula-qovrula* (z.) *qaldı.* A.Şaiq. *Bir ağrı başladı, qovrulub-yandım; Ağrıyır deməyə bəzən utandım.* Ə.Cavad.

**QOVRULMUŞ** *sif.* Od üstündə qızardılaraq bişirilmiş. *Tavada qovrulmuş cücə. Qovrulmuş ət. Qovrulmuş günəbaxan toxumu. Qovrulmuş badam. – Hər məcməyinin içində bir nimçə plov, onun üstündə bir toyuq, toyuğun içində yağla qovrulmuş kişmiş, axta olardı.* H.Sarabski.

**QOVRUMGÖZLÜ** *sif.* Gözləri qonur olan. [Nəsir] *iri qovrumgözlü, buğdayı bənizli arıqca bir aran uşağı idi.* H.Nəzərli.

**QOVŞAQ** *is.* Bir neçə şeyin (rabitə xətlərinin, yolların, çayların, kanalların və s.-nin) qovuşduğu, birləşdiyi yer, nöqtə. *Dəmiryol qovşağı. Radio-translyasiya qovşağı. Su-elektrik qovşağı* (elektrik stansiyaları, kanallar və s. məcmusundan ibarət böyük inşaat). *– Gəray isə dənizə baxıb deyir: – Təzə şəhər yollar qovşağında tikilir, böyük rabitələr şəhəri olacaq.* Mir Cəlal.

**QOVUQ** *is.* 1. İçi hava ilə dolu qabarcıq, köpürcək. *Balıq arabir üzə çıxıb ağzından qovuqlar buraxır. – İki tənəffüslü balıqlar üzmə qovuqları vasitəsilə havada da tənəffüs edə bilirdi.* M.Axundov.

2. İnsan və heyvan bədənində maye, yaxud şirə ilə dolu kisəcik.

3. Hər hansı bir səbəb üzündən dərinin üstündə əmələ gələn yumru şiş, qabarıq. *Gözün üstü şişib olubdu qovuq; Zahirən bu gecə dəyibdi soyuq.* S.Ə.Şirvani.

4. Müxtəlif məqsədlər üçün işlədilən, içi hava, yaxud su ilə doldurulan rezindən və s.-dən düzəldilmiş kisəcik.

**QOVUQCUQ** *is.* Kiçik qovuq, incə qovuq.

**QOVUQLANMA** "Qovuqlanmaq"dan *f.is.*

**QOVUQLANMAQ** *f.* Qovuqlar, qabarcıqlar əmələ gəlmək.

**QOVUQLU** *sif.* Qovuğu olan.

**QOVULMA** "Qovulmaq"dan *f.is.*

**QOVULMAQ** "Qovmaq"dan *məch. Evdən qovulmaq. İşdən qovulmaq. Mal-qara qovulub ağıla salındı. Ceyran xeyli qovulduqdan sonra vuruldu. – Vahidin institutdan qovulmaq xəbərini eşidəndə Rübabə bərk narahat oldu.* Mir Cəlal.

**QOVUN** *is.* Qabaq fəsiləsindən uzunsov, yaxud girdə şəkilli, şirin və ətirli bostan meyvəsi; yemiş. *Bostançı qovun dərdi; Kal dərdi, qovun dərdi; Yığılın, qohum-qardaş; Üstümdən qovun dərdi.* (Bayatı).

**QOVUNAĞACI** *is. bot.* İsti ölkələrdə bitən bir ağac.

**QOVURĞA** *is.* Qovrulmuş buğda, düyü, darı və s. dənələri. *Qovurğa qarın doyurmaz.* (Ata. sözü). *Çaydanımız ərsin üstə qaynardı; Qovurğamız sac içində oynardı.* Şəhriyar. □ **Qovurğa kimi** – çox quru şey haqqında.

**QOVURMA** *is.* 1. "Qovurmaq"dan *f.is.*

2. Yağda qovrulmuş ətdən ibarət xörək. *Odur, küpdə qovurma var, ocağı alışdırın, isidin, dağarcıqdan əppək alın, yeyin.* M.Rzaquluzadə. *Həyəti götürən soğan, qovurma, zəfəran iyi adamı valeh edirdi.* Mir Cəlal. // Bəzi mürəkkəb xörək adlarının tərkib hissəsinə daxil olur. *Qovurma kabab. İç qovurması.*

**QOVURMABOZBAŞ** *is. aşp.* Şirəsi çox olan qovurma.

**QOVURMAÇI** *is. köhn.* Ümumiyyətlə, ət və xüsusilə içalat (qoyun içalatı) bişirib satan adam. [Övrət:] *Qardaş, bihəyalıq edirəm, bağışla, on il bundan əqdəm məni bir qovurmaçıya ərə verdilər.* N.Vəzirov. // *sif.* Qovurmaçılıqla məşğul olan. *Atası qovur-*

*maçı Səlim öz övrətinə deyir: "Övrət, bu uşağın məktəbə getmək vaxtıdır; mənim sənətim də bir elə sənət deyil ki, aparım, bu yazığa da öyrədim*". Ə.Haqverdiyev.

**QOVURMAÇILIQ** *is.* Qovurmaçı peşəsi, qovurmaçı sənəti.

**QOVURMAÇİLOV** *is. aşp.* Xuruşu qovurma və qızarmış badımcan olan çilov növü.

**QOVURMAQ** *f.* 1. Susuz olaraq yalxı və ya yağda bir şeyi od üzərində qabda qızartmaq, bişirmək. *Əti yağda qovurmaq. Balığı tavada qovurmaq.*

2. Yandırmaq. *Gün lap adamı qovurur.* // Məc. mənada. *İri, rəngsiz dodaqlarını biixtiyar bir "ah" qovurdu.* A.Şaiq. *Şübhə alovları həqiqətən onu yandırır və qovurğa kimi qovururdu.* S.Rəhimov.

**QOVURMALI** *sif.* Yanında qovurma olan, qovurma ilə bərabər yeyilən. *Qovurmalı aş. Qovurmalı xingal.*

**QOVURMALIQ** *sif.* Qovurmaya, qovurma bişirməyə yarar. *Qovurmalıq ət.*

**QOVURMAPLOV** *is. aşp.* Xuruşu qovurmadan ibarət olan plov.

**QOVURTMAQ** "Qovurmaq"dan *icb.*

**QOVUŞ** *is.* At qovma, at minib çapma. *Qovuş meydanı.*

**QOVUŞDURMA** "Qovuşdurmaq"dan *f.is.*

**QOVUŞDURMAQ¹** *f.* 1. Birləşdirmək, bitişdirmək. *Çayın qollarını qovuşdurmaq. – Firəngistanın və ingilisin dövlətli kəsləri iki icma bina ediblər ki,* [La-Manşın] *altında bir dəmiryol saldırıb, məzkur məmləkətləri qovuşdursunlar.* "Əkinçi". *Cinsi hibridləşdirmə dedikdə, iki müxtəlif orqanizmin* [bitki və ya heyvan] *cinsi hüceyrələrini qovuşdurub mayalanması yolu ilə hibrid almaq nəzərdə tutulur.* M.Axundov.

2. Görüşdürmək, birləşdirmək. [Xanpəri:] *Muğanlı Səfərəli qızını sevgilisinə qovuşdurmadımı?* M.F.Axundzadə. *Bu yanan sinəmi ovuşdurram; Başqa bir sinəyə qovuşdurram.* A.Səhhət.

**QOVUŞDURMAQ²** *f.* At çapmaq, yarışmaq.

**QOVUŞDURUCU** *sif.* Bitişdirici, birləşdirici. *Süxurların xüsusi çəkisi onların dənələrinin mineraloji tərkibindən, quruluşundan, qovuşdurucu maddəsindən və s. asılıdır.* Quliyev.

**QOVUŞDURULMA** "Qovuşdurulmaq"-dan *f.is.*

**QOVUŞDURULMAQ** *məch.* Bitişdirilmək, birləşdirilmək.

**QOVUŞMA¹** "Qovuşmaq¹"dan *f.is.*

**QOVUŞMA²** "Qovuşmaq²"dan *f.is.*

**QOVUŞMAQ¹** *f.* 1. Birləşmək, bitişmək. *İki yolun qovuşduğu nöqtə. Çayın qolları kəndin yanında qovuşur. Çayların suyu bir-birinə qovuşub axırda dənizə tökülür. – Turşsu çayların içi ilə Araza axır, Kürə qovuşur.* S.Rəhimov.

2. *məc.* Bir şeylə birləşərək onun içində yox olub getmək. *Qurğuşun rənginə çalan buludlar şəhər üzərindən ağır-ağır gəlib ötdükdə, elə bil dənizlə göy qovuşurdu.* M.Hüseyn. *Sabahın zülməti hər tərəfi qaplamışdı. Qarşıda görünən gündüzkü dağlar indi belə qaynayıb qaranlığa qovuşmuşdu.* S.Rəhimov. *Qara buludlu göy də, işıqsız yer də hər ikisi bir-birinə qovuşmuşdu.* Ə.Məmmədxanlı. // Bir-birinə lap yaxınlaşmaq, bir-biri ilə birləşmək, aralarındakı məsafə, sərhəd yox olub getmək, birləşərək bir bütöv şəklini almaq, bitişmək. *Yaranın ağzı qovuşub. – Bəzi vaxtda çatlaq zəlzələdən sonra da qalır. Amma bəzi vaxtda onun qıraqları genə gəlib qovuşur.* H.Zərdabi.

3. Görüşmək, ayrılıq və hicrandan sonra vüsala çatmaq, birləşmək. [Heydər bəy:] *..Biz bir-birimizi nəhayətdə sevirdik. İki il idi qovuşmaq həsrətini çəkirdik.* M.F.Axundzadə. *Yaxında hərbi vəzifəni bitirər, yenə də sevimli ailənə qovuşarsan.* M.S.Ordubadi. [Qurban] *yolda yeriyərək düşünürdü: xoşbəxt adam kifayət qədər pul toplamış, indi də gedib uşaqlarına qovuşacaqdır.* A.Şaiq. // Çatmaq, yetişmək, nail olmaq. *Həsrətinə qovuşmuş heyvancıqlar ayaqlarını bükərək, quyruqlarını oynada-oynada analarının məmələrini əmirdilər.* A.Şaiq. *İllər gəlib keçir, dövran xoş gəlir; Ağ günə qovuşur yenə də vətən.* S.Vurğun. *Biz qismətimizə düşən ağır yolu keçməsək, gələcək nəsillərimiz də o işığa tez gəlib qovuşmaz.* Ə.Məmmədxanlı.

4. Sağalmaq, ağzı örtülmək, dərisi birləşmək, bitişmək (yara haqqında). *Yara sağalıb qovuşmuşdur.*

5. Bəzi isimlərin yanına gətirilərək, mürəkkəb feil və ifadələr düzəldilir; məs.: qaranlıq qovuşmaq, toran qovuşmaq, əbədiyyətə qovuşmaq.

**QOVUŞMAQ²** *qarş*. 1. Bir-birini qovmaq, biri digərinin ardınca yüyürmək, bərk qaçmaqda yarışmaq. *Uşaqlar həyətdə qaçıb qovuşurlar*.

2. At yarışında bir-birini keçməyə, ötməyə, arxada qoymağa çalışmaq. *At qovuşmaq*.

**QOVUŞUQ** *sif.* Bitişik, bir-birinə bağlı, arası olmayan; bütöv.

**QOVUŞUQLUQ** *is.* Qovuşuq şeyin halı; bitişiklik, bir-birinə bağlılıq.

**QOVUT** *is.* Qovrulmuş buğda, noxud və s. unundan hazırlanan və bəzən şəkər tozu və s. ilə qarışdırılıb yeyilən çərəz.

◊ **Ağzına qovut verən yoxdur** – əhəmiyyət verən yoxdur, qulaq asan yoxdur.

**QOVZADILMAQ** *məch.* Qaldırılmaq.

**QOVZAMA** "Qovzamaq"dan *f.is.*

**QOVZAMAQ** *f. dan.* Qaldırmaq. [Oruc:] *Bəli, tüfəngin çaxmağın yuxarı ayağa qovza ki, hamımız birdən tüfəngləri boşaldaq*. M.F.Axundzadə. *Dilmanc əlindəki kağızı yuxarı qovzayıb başladı oxumağa*. C.Məmmədquluzadə. *Başımı yavaşca qovzayıb yan-yörəmə baxdım. Heyvan sümüyündən və zibildən savayı bir şey görmədim*. Çəmənzəminli.

**QOVZANMAQ** *məch.* Qaldırılmaq.

**QOVZATMAQ** *icb.* Qaldırtmaq.

**QOY** *əd.* İcazə, razılıq, əmr, lazımlıq bildirir. *Qoy qalsın. Qoy fikirləşsin. İstəyirsə, qoy getsin. Qoy uşaqlar həyətdə oynasınlar. Qoy bu işi o görsün. – Kim ki bu halə düşmədi, qoy vara kəndi halinə*. Nəsimi. *Qapında inləyim mən; Sözün de, dinləyim mən; Qoy axsın gözüm yaşı; Bir az sərinləyim mən*. (Bayatı). *İş apar, baş gedərsə, qoy getsin; Ad qalır, bəs deyilmi, millət ilə?* M.Ə.Sabir. [Ağca xanım:] *Qoyun! Yol verin! Həyat bağçasına su gəlir, qoyun, sel də olsa, səhraları bassın.* Mir Cəlal. // Arzu bildirir. *Qoy o göylərdəki ulduzlara çatsın səsimiz!* S.Rüstəm. // Xüsusi intonasiya ilə söylənilərək, hədə bildirir. *Qoy bir o bura gəlsin, mən ona göstərərəm.*

**QOYDURMAQ** "Qoymaq"dan *icb. Surxay partladılacaq qayaya göz gəzdirdi. Dinamit qoydurdu*. M.İbrahimov.

**QOYMA** 1. "Qoymaq"dan *f.is.*

2. *sif.* Əslində olmayıb sonradan qoyulmuş; süni. *Qoyma diş. – Qoyma xaldan xal olmaz*. (Ata. sözü).

**QOYMAQ** *f.* 1. Bir şeyi bir yerə buraxmaq, bir şeyi bir yerə yerləşdirmək. *Kitabı şkafa qoymaq. Paltarları sandığa qoymaq. Şeyləri yerinə qoymaq. Yaylığı cibinə qoydu.* – [Qulu:] *Otaq təmizdir. Ancaq heç şeyimiz yoxdur ki, qoyaq.* N.Nərimanov. *Kərim kitabı büküb pəncərəyə qoydu*. M.İbrahimov.

2. Əmanət vermək, tapşırmaq, saxlamaq üçün vermək. *Pullarını əmanət kassasına qoymaq. Pullarını banka qoymaq.*

3. Oxumaq, işləmək və s. üçün bir yerə göndərmək, vermək, düzəltmək. *Uşaqları məktəbə qoymaq. İşə qoymaq. – Ona binaən onu uşaq ikən gətirib şəhri-Qəzvində məktəbə qoydu*. M.F.Axundzadə. *Ağca xanımın təkidi ilə Gəldiyev İzzəti bağçaya qoydu.* Mir Cəlal.

4. Bir şey etməyə icazə vermək, yol vermək, imkan vermək, buraxmaq. [Cənnət:] *Mirzə, .. o məni o qədər yandırıbdır ki, bundan sonra onu evə də qoymaq istəmirəm.* N.Vəzirov. *Ədə, Həsənəli, qoyma, öküz girdi bağçaya, ağacları sındıracaq.* C.Məmmədquluzadə.

5. Rahat buraxmaq, imkan vermək. *Bir tacirin şöhrətinin dərdi qeyri bir taciri qoymaz yuxu yuxlasın.* C.Məmmədquluzadə. *Lakin qəza təşkilatları Qəhrəmanı özlüyündə qoymur, onu o yan-bu yana çəkişdirirlər*. S.Rəhimov.

6. Təxir etmək, saxlamaq, sonraya buraxmaq, başqa bir vaxta keçirmək, ləngitmək. *Bu günün işini sabaha qoyma! Söhbəti sonraya qoyaq. İmtahanı axşama qoydular. – Yarın vüsalın istə bu gün, qoyma yarına; Yarın vüsalı yarına qalmaq gümanədir*. Nəsimi.

7. Həvalə etmək, yükləmək, tapşırmaq. *Usta adı böyük addır, bu ad hər adamın üzərinə böyük vəzifələr qoyur.*

8. Təsis etmək, tikmək, qurmaq. *Heykəl qoymaq. Abidə qoymaq. – ..Bu axır vaxtlarda Qafqazın müsəlmanları gözlərini açıb başlayıblar hey bir ucdan məktəb binası qoymağa*. C.Məmmədquluzadə. *Dənizdə*

*buruq qoymağın çətinliyini yoldaşlar yaxşı bilirlər.* M.Hüseyn.

9. Geymək, yaxud geydirmək, başına keçirmək. *Başına araqçın qoymaq.* – [Rəxşəndə] *saçlarını vurdurmuş, başına çəpəki olaraq qırmızı rəngli qadın papağı qoymuşdu.* M.İbrahimov. *Gənc qızlar yüyürüşüb oğlanın başına ətirli dağ çiçəklərindən .. çələnglər qoydular.* M.Rzaquluzadə.

10. Sərf etmək, işlətmək, xərcləmək. *Pul qoymaq. Maya qoymaq. Mən bu işə zəhmət qoymuşam. – Bir də ayrıca-ayrıca yazıb göstərərdi ki, qonşularından nə qədər pul borc alıb, bayram süfrəsinə qoyubdur*. S.Rəhimov.

11. Müəyyən bir təsir əmələ gətirmək məqsədi ilə bir şeyin üstünə, arasına yerləşdirmək, salmaq, döşəmək. *Kompres qoymaq. Zəli qoymaq. Xəstəyə banka qoymaq. Termometr qoymaq.*

12. Təyin etmək. *Məsul işə qoymaq. Növbətçi qoymaq. Onu zavoda direktor qoyublar.*

13. Müəyyən etmək. *Vaxt qoymaq. Möhlət qoymaq*.

14. Həll etmək, yerinə yetirmək, yaxud müzakirə üçün irəli sürmək, təklif etmək. *Məsələni ciddi qoymaq. Qərarı müzakirəyə qoymaq*.

15. Yazı ilə ifadə etmək, işarə etmək; yazmaq. *Durğu işarələri qoymaq. Şagirdə "yaxşı" qiymət qoymaq. Nişan qoymaq.*

16. Düzəltmək, təşkil etmək, tərtib etmək. *Tamaşaya qoymaq. Təcrübə qoymaq*.

17. Bir adam və ya şey üçün hər hansı bir şərait, vəziyyət yaratmaq, bu və ya digər vəziyyətə, şəraitə düşməsinə səbəb olmaq. *Çətin vəziyyətdə qoymaq. – Bəndə saldın mənim kimi dustağı; Çox məni qoyubsan darda, gül, Pəri*. Aşıq Abbas. *Kitayda yapon malını boykot eləyib, yapon karxanalarını işsiz qoyublar*. C.Məmmədquluzadə. [Pristav:] *Bu kasıb bədbəxtin öküzünü aparıbsan, əli qoynunda qoyubsan*. Ə.Haqverdiyev.

18. Bir şeyə lazımi vəziyyət vermək, lazımi şəklə salmaq. *Gəzərkən ayaqlarını düzgün qoymaq*.

19. Uzatmaq, saxlamaq. *Saç qoymaq. Bığ qoymaq. Saqqal qoymaq*.

20. Gedərkən özü ilə bərabər götürməmək, olduğu, çatdığı, gəldiyi yerdə buraxmaq. *Uşaqları evdə qoymaq. Gözlüyümü evdə qoymuşam. – İskəndər onlara* [qala əhlinə] *başqa yer verib, qalanı təmir etdirdi və orada bir qədər qoşun qoydu. ..*A.Bakıxanov.

21. Hər hansı bir vəziyyətdə, şəkildə, halda saxlamaq. *Məsələni açıq qoymaq* (*həll etməmək*). *Məni rahat qoy! Bu hadisə bizi heyrətdə qoydu.*

22. Saxlamaq. *Axşama bir az çörək qoy*.

23. Buraxmaq, buraxıb getmək, tərk etmək, atmaq, atıb getmək (bəzən "qoyub getmək" şəklində işlənir). *Yoldaşını təhlükədə qoyma! Ailəsini qoyub getdi. – A kişi, ya bez, ya zər, sizə nə? Nə gətirdi öz evinə aparacaq. Sənin evində ki qoymayacaq*. H.Sarabski. *Əziziyəm, bir yana; Bir alışa, bir yana; Camalın müştağıyam; Qoyub getmə bir yana.* (Bayatı).

24. Keçmək, fəda etmək, sərf etmək, həsr etmək. *Vətən yolunda canını qoymaq. – Yolunda qoydu Nəsimi cahan ilə canı.* Nəsimi.

25. *dan.* Kəsilmək, dayanmaq, yox olmaq. *Dişimin ağrısı qoydu*.

26. Bir sıra isimlərə qoşularaq mürəkkəb feil və müxtəlif ifadələr düzəldilir; məs.: ad qoymaq, qol qoymaq, çay qoymaq, səsə qoymaq, lağa qoymaq, araya qoymaq.

**QOYULMA** "Qoyulmaq"dan *f.is.*

**QOYULMAQ** *məch.* 1. Bir yerə yerləşdirilmək; düzülmək. *Kitabların hamısı şkafa qoyuldu. – Bir azdan sonra stol üzərinə qələm, kağız və mürəkkəb qoyuldu.* M.S.Ordubadi. *Sürahilər şərbət və şərablarla doldurulub, sərin bulaqlara qoyulmuş*(*du*). M.Rzaquluzadə.

2. Əmanət verilmək, saxlanmaq üçün verilmək. *Pullar əmanət kassasına qoyulmuşdur.*

3. İcazə verilmək, müsaidə edilmək, rüsxət verilmək, imkan verilmək, buraxılmaq. *Heç kəs içəri qoyulmur. Zala adam qoyulmur.*

4. Oxumaq, işləmək və s. üçün bir yerə göndərilmək, verilmək, düzəldilmək. *Uşaqların üçü də məktəbə qoyulmuşdur.*

5. Saxlanmaq, təxirə salınmaq, ləngidilmək, keçirilmək. *İclas sabaha qoyulmuşdur*.

6. Tapşırılmaq, həvalə edilmək. *Üzərimizə çox məsul vəzifələr qoyulmuşdur. Siyahını tutmaq onun öhdəsinə qoyulmuşdur.*

7. Yüklənmək, vurulmaq. *Arabalara ağır yük qoyulmuşdur*.

8. Təsis edilmək, tikilmək, qurulmaq. *Dənizin içində çoxlu buruq qoyulmuşdur. Dünən klub binasının özülü qoyuldu. – Qoyuldu özüllər, boylandı tağlar*. M.Müşfiq.

9. Geyilmək, keçirilmək. *Başa papaq qoyulmaq*.

10. Sərf edilmək, işlənmək. *Bu işə çoxlu zəhmət qoyulmuşdur*.

11. Bir şeyin üstünə, yaxud arasına yerləşdirilmək, salınmaq, döşənmək. *Kompres qoyulmaq. Quyunun ağzına böyük bir daş qoyulmuşdur.*

12. Təyin edilmək. *Məsul işə qoyulmaq. Növbətçi qoyulmaq. – Kəndin ətrafına qarovul qoyuldu*. M.Hüseyn.

13. Həll edilmək, yerinə yetirilmək, yaxud müzakirə üçün irəli sürülmək, təklif edilmək. *Məsələ ciddi qoyulmuşdur.*

14. Yazılmaq, işarə edilmək. *Durğu işarələri düzgün qoyulmamışdır*.

15. Düzəldilmək, təşkil edilmək, tərtib edilmək. *Bu gecə səhnədə hansı pyes qoyulacaqdır? Təcrübə qoyulmaq.*

16. Müəyyən edilmək, qərarlaşdırılmaq, lap ibtidadan verilmək. *İnsanın təbiətində iki ümdə xasiyyət qoyulubdur*. M.F.Axundzadə.

17. Saxlanılmaq. *Axşama heç bir şey qoyulmayıbdır*.

**QOYULUŞ** *is.* 1. Qoyulma (b a x **qoyulmaq** 10-cu mənada). *Su təsərrüfatı tədbirlərinə kapital qoyuluşu 50 faizdən çox artmalıdır.*

2. Qoyulmaq tərzi, qoyulmaq qaydası. *Kərpicin qoyuluşu*.

3. İrəli sürülmə, meydana atılma. *Məsələnin qoyuluşu, müzakirəsi və həlli elə gəlib yetişmişdi ki, burada hiylə olduğunu heç kəs güman etməzdi.* Mir Cəlal.

**QOYUM** *is. köhn.* Qızıl və gümüşdən düzəldilmiş bəzək şeyləri, ya qab-qacaq.

**QOYUMÇU** *sif. köhn.* Qızıl-gümüşdən qabqacaq, bəzək şeyləri qayıran usta; zərgər.

**QOYUMÇULUQ** *is. köhn.* Qoyumçu sənəti, qızıl və gümüşdən qab-qacaq və zinət şeyləri qayırmaq sənəti; zərgərlik.

**QOYUN**[1] *is.* Ət, yun və süd verən sıx, qıvrım tüklü gövşək ev heyvanı. *Alışan tayaların işığında hürküşüb bir-birinə qarışmış qoyun sürüləri mələşir.* M.Rzaquluzadə.

◊ **Qoyun kimi** – təbiətcə çox yumşaq, həlim, sakit, dinc. **Qoyunu qoyun ayağından, keçini keçi...** – hər kəsə öz əməlinə, işinə və s.-yə görə yanaşmalı, qiymətləndirməli. **Qoyunu qurda tapşırmaq** – etibar edilə bilməyən adam haqqında. **Qurdla qoyun bir yerdə otlayır** – əmin-amanlıq, asayiş, dinclik mənasında.

**QOYUN**[2] *is.* 1. Ağuş, qucaq. *Anası uşağı qoynuna alıb yatdı. – Necə ki, insana qurbağanı ələ alıb qoynuna qatmaq nagüvara gələr, elə də bəlkə bundan artıq Zeynəbə Xudayar bəyin iri burnuna və kifir sifətinə baxıb ona ər demək nagüvara və naxoş görünürdü.* C.Məmmədquluzadə. *Bütün bir səhəri yalvardım durdum; Boş qalmış qoynuna çiçək doldurdum.* Ə.Cavad. // Obrazlı təsvirlərdə. *Xəzər dənizinin qoynuna girmiş olan Bakı şəhərinin gecəsini .. elektrik işıqları alaqaranlıq bir səhərə çevirmişdi.* A.Şaiq. [Beyrək] .. *yüyürüb özünü köpüklənən dalğaların qoynuna atdı.* M.Rzaquluzadə.

2. Paltarın döşə qovuşan yeri, döşü; qoltuq. *Molla İbrahim Xəlil .. saatı qoyun cibindən çıxarıb baxır*. M.F.Axundzadə. *Mən kağızı qoynumdan çıxarıb ona verdim*. M.S.Ordubadi. *Kiçikxanım şəkli qoynuna qoydu*. Mir Cəlal.

**QOYUNBOĞAN** *is. bot*. Rütubətli yerlərdə bitən alaq bitki.

**QOYUNÇU** *is.* 1. Qoyunçuluq mütəxəssisi. // Qoyun saxlamaqla, qoyunçuluqla məşğul olan adam, təsərrüfat. *Keçən təsərrüfat ilində qoyunçularımız hər yüz ana qoyundan yüz quzu almışlar*.

2. *köhn.* Satmaq məqsədi ilə qoyun yetişdirib saxlayan adam; sərkar.

**QOYUNÇULUQ** *is. k.t.* Qoyun yetişdirmə, qoyun saxlama. *Qoyunçuluq sovxozu. Qoyunçuluq təsərrüfatı. Kolxozun qoyunçuluq ferması. Qoyunçuluğun inkişafı.*

**QOYUN-QUZU** *top*. Qoyunlar, quzular bir yerdə; davar. *Çöldən gəlir mal-qara, mələşir qoyun*-quzu. R.Rza.

**QOZ** *is.* 1. Bərk qabıqlı, qoşa ləpəli bir meyvə. *Qoz ləpəsi. – Teyibə evə yolu düşəndə Bahadır üçün həmişə fındıq, qoz, saçaqlı konfet, iydə və bəzən xurma gətirirdi*. M.Hüseyn. // Bu meyvənin ağacı. *Qoz*

*ağacından əla mebel hazırlanır. – Molla Qasım həyətdə qoz ağacının altında həsir saldırıb uzanmışdı.* S.S.Axundov.

2. *dan*. Qoza oxşayan şiş, ur, çıxıq. *Alnından qoz çıxıb*.

◊ **Qoz qabığına girmək** – qorxudan qaçıb özünə bir sığınacaq tapmaq, qorxudan qaçıb gizlənmək. **Qoz qabığına salmaq (soxmaq)** – çox sıxışdırmaq, çıxılmaz vəziyyətə salmaq. **Qoz-qoz oynamaq** – bəhsləşmək, dikbaşlıq etmək. [Xasməmməd:] *Ancaq bir şərtlə ki, o .. bizimlə qoz-qoz oynamasın*. C.Cabbarlı. **Qozunun üstünə qoz qoymaq** – *dərdini daha da artırmaq, işini daha da çətinləşdirmək*.

**QOZA** *is.* 1. Palıd, şam və qayın ağaclarının qoza oxşayan yeyilməyən meyvəsi. *Səndə bitər bir neçə vecsiz qoza; Ancaq o da qismət olar donquza*. M.Ə.Sabir.

2. Pambıq kolunun hələ açılmamış, yuvarlaq şəkilli və içində pambıq olan qönçəsi. *Pambıq qozası. – Vıyıldayan şiddətli külək pambıq kollarını dalğalandırır, qurumuş qozaları xəzəl kimi xışıldadırdı*. M.Hüseyn.

3. Keçmişdə qadın paltarının qollarında gümüş, ya qızıldan yuvarlaq bəzək.

**QOZACIQ** *is.* Balaca qoza, kiçik qoza.

**QOZALAMA** "Qozalamaq"dan *f.is.*

**QOZALAMAQ** *f.* Qoza gətirmək, qoza ilə örtülmək, düymələnmək (pambıq, palıd ağacı və s.). [Pambıq kollarının] *biri açılmağa başladığı halda, digəri yenicə qozalayırdı*. Ə.Vəliyev.

**QOZALANMA** "Qozalanmaq"dan *f.is.*

**QOZALANMAQ** *f.* Qoza halına gəlmək. *Qoza tökmək*.

**QOZAVARİ** *sif.* Qoza kimi, qozaya oxşayan.

**QOZBEL** *sif.* 1. Döş və ya arxa sümüklərinin əyilməsi nəticəsində beli qoz kimi qalxıq; donqar. *Qozbel adam*. – [Qulu:] *Podnos elə köhnədir ki, ortası qozbel adamın beli kimi qalxıbdır*. S.S.Axundov. // İs. mənasında. [Dilbər:] *Doğru demişlər: qozbeli qəbir də düzəldə bilməz*. C.Cabbarlı.

2. Bükülmüş, əyri, bir tərəfi çıxıq. *Qozbel tir. Qozbel divar*.

**QOZDƏSTƏ** *is. dan. zar.* Tapança. *Zeynal .. Veysin belindəki tapançaya baxıb, astadan zarafatla dedi: – Bəlkə sən bu qozdəstəni çayqıraqlılara göstərmək istəyirsən?* Ə.Əbülhəsən.

**QOZQURAB** *is. bot.* Tarlalarda torpaq altında bitən kiçik kartofa bənzər kök bitki.

**QOZQUR(T)MAQ** *f. dan.* Özündən uydurub söyləmək, uydurma sözlər danışmaq, əcaib şeylər danışmaq, cəfəngiyat danışmaq, lovğalanmaq, öyünmək, gop basmaq. [Divanbəyi:] *A kişi, sən nə qozqurursan?* M.F.Axundzadə. [Mirzə Səməndər:] *A kişi, sən çox qozqurtma ha! Sənin kimiləri çox görmüşük*. C.Cabbarlı.

**QOZLA, QOZLU** [*rus.* кóзлы] Araba və fayton kimi miniklərdə sürücü oturan yer; şahnişin. *..Bacım Tutunu, on səkkiz yaşındakı oğlunu da qoydum faytona, kuçerimiz Əsədi mindirdim qozluya və özüm də mindim*. C.Məmmədquluzadə. *Gədə də tüfəngi götürüb yuxarıda, qozluda əyləşdi*. S.Rəhimov. *Qozlada oturan başınişanlı fərraş yerə tullandı*. P.Makulu.

**QOZLANMA** "Qozlanmaq"dan *f.is.*

**QOZLANMAQ** *f. dan.* Kibrlənmək, təşəxxüslənmək, qürrələnmək, lovğalanmaq, kişilənmək.

**QOZLUQ** *is.* Çoxlu qoz ağacı bitən yer, qoz meşəsi.

**QÖNÇƏ** *is.* [*fars.*] Açılmamış qızılgül və ya başqa çiçək; gül və ya başqa çiçəyin tumurcuğu. *Qızılgül qönçə açmışdır. – Bülbül qonub qönçə üstə; Nə şirin dillər açılıb*. Aşıq Əli. // *Sif. mənasında*. Açılmamış, qönçə halında olan. *Qönçə gül. – Ətir saç aləmə, sən, ey qönçə gül!* S.Vurğun. // Obrazlı təşbehlərdə. *Qaydasıdır qönçə yatar xar ilə; Bülbül kimi zimistanə gözlərin*. Aşıq Pəri. *Mürur ilə gül qönçəsi açılar; O, zor ilə açılsa, bərbad olar*. M.Möcüz. *Sən sevgili vətənciyimin gül fidanısan! Sən bir gözəlcə qönçəsən, amma yabanısan!* A.Səhhət. // Al, qızılgül rəngi. *Bir anda qızın yanaqlarını bir bahar qönçəsinin rəngini andıran qızartılar bürüdü*. M.İbrahimov. // *klas*. Gözəlin ağzı, dodaqları, yaxud özü qönçəyə oxşadılır. *Ey qönçə ağızlı, bəni yandırdı hicrin dikəni; Gəl, gəl ki, sənsiz qönçə tək doldu içim qan, qandasan?* Nəsimi. *Könlüm açılır zülfipərişanını görcək; Nitqim tutulur qönçeyi-*

*xəndanını görcək.* Füzuli. *Qamətin tək heç bir qamət biçilməz; Dodaqların tər qönçədən seçilməz.* M.P.Vaqif. *Çiçəklər açarkən gülüşlərindən; Xəlq olmuş o qönçə dodağın sənin!* A.Şaiq.

**QÖNÇƏCİK** *is.* Zərif qönçə. *Şəmə pərvanə şövqmənd olmuş; Qönçəciklər həbibidir budağın.* A.Səhhət.

**QÖNÇƏDƏHAN, QÖNÇƏDƏHƏN** *sif.* və *is.* [*fars.*] *klas.* Ağzı qönçə kimi kiçik və gözəl. *Bir təbəssüm qıl xuda üçün, güli-qönçədəhan.* Kişvəri. *Ey qönçə-dəhanü sərvqamət; Gül, oyna, zəmani et fərağət!* Füzuli. *Soruşdum qızlardan, Allahı sevən; Neçin mükəddərdi o qönçədəhən?* Q.Zakir. [Şeyx Sənan:] *..Söylə, ey nazənin qönçədəhən! Söylə, ruhum, nə tez unutdun sən.* H.Cavid. *Könlümü qan eyləyən varmı bu aləmdə məgər; Bir sənin tək üzü-gül, qönçədəhəndən qeyri?* Ə.Vahid.

**QÖNÇƏDODAQ(LI)** *sif.* Dodaqları qönçə kimi gözəl, zərif. *Ucaboylu, incəbelli, qönçədodaqlı .. qız utanaraq, qumral saçlarını üzünə örtüb, ürkmüş maral kimi evə qayıdır.* H.Sarabski.

**QÖNÇƏLƏB** *sif.* [*fars.*] bax **qönçədodaq(lı)**.

**QÖNÇƏLƏNMƏ** "Qönçələnmək"dən *f.is.*

**QÖNÇƏLƏNMƏK** *f.* Qönçə açmaq; açılmaq. *Sənin açıq, ağ alnını öpdü sərin küləklər; Hər addımın dəyən yerdə qönçələndi çiçəklər.* S.Vurğun. *Laləli yaz gəlsin, gül qönçələnsin; Yetişsin bülbüllər gülə, sevgilim!* Aşıq Hüseyn. // Məc. mənada. [Ağabəyim ağanın] *yalnız ağ tafta köynəkdə qönçələnən köksü həyəcan içində çırpınırdı.* Çəmənzəminli.

**QÖNÇƏLİ** *sif.* Qönçə açmış, çiçəkli, güllü. *Pəncərədən baxanda qumluq səhra yox, yaşıl ağaclar, güllü qönçəli kollar görünsün.* Mir Cəlal.

**QÖNÇƏLİK** *is.* Gülün qönçə halı, qönçə vaxtı. *Gül qönçəlikdə gərçi olur xarə aşina; Açsa niqabını, olur əğyarə aşina.* S.Ə.Şirvani.

**QÖVL** *is.* [*ər.*] Söz, danışıq. *Onun qövlü ilə işi düz gəlmir. – Qövli-zahidlə əməl etməmişəm həşr günü; Var ümidim ki, mənə dadrəs olsun bu əməl.* S.Ə.Şirvani. *Mənəm-mənəm deyənlərin inanma çox da qövlünə; Gərəkli gündə onların qıçındakı fərari gör!* M.Ə.Sabir.

**QÖVLƏN** *zərf* [*ər.*] Sözlə, sözlə olaraq (*felən* ziddi).

**QÖVM** [*ər.*] Kiçik xalq, tayfa. *Bu qövm bizim vətənimizin başına elə müsibətlər gətirmişlər və onun xarabalığına səbəb olmuşlar ki, onları xatırlayarkən ağıllı bir insanı ağlamaq tutmaya bilməz.* M.F.Axundzadə.

**QÖVMİ** *sif.* [*ər.*] Qövmə mənsub olan, bir xalqa aid olan.

**QÖVMİYYƏT** *is.* [*ər.*] Bir qövmə, bir xalqa mənsub olma. *Çünki buna onların qövmiyyəti də icazə verir.* M.S.Ordubadi.

**QÖVR: qövr etmək** – narahat etmək, incitmək, daim özünü hiss etdirmək. *Sinəsinə vurulan yara yenidən qövr elədi.* Mir Cəlal. *Səlim ürəyində qövr edən dərdi gizlədə bilmədi.* M.Hüseyn. *Qocanın ifadəsindəki inam çobanı tutdu, ürəyində qövr edən odu soyutdu.* M.Rzaquluzadə. *Son qoysun bu gecə, əsr-əsr; Ürəklərdə qövr eləyən, möhnətə, dərdə.* R.Rza.

**QÖVS** *is.* [*ər.*] 1. Yay, kaman. // Şəkilcə qövsü xatırladan, qövsə oxşayan şey. *Qəzadır qaşların qövsi, qədərdir kirpigin səhmi; Bəni amac üçün eynin bu məninдən nişan etdi.* Nəsimi. *Qızların qövs qaşları və sehirli gözləri qaraldı.* M.S.Ordubadi. *..Fişənglər havada qırmızı qövs təşkil edərək, arxaya əyilib söndü.* Ə.Əbülhəsən.

2. *hənd.* Dairə çevrəsinin və ya digər əyri xəttin bir hissəsi. *Dairənin qövsü. Qövs cızmaq.*

3. Xüsusi terminologiyada: **qövs lampaları, generatorları, fənərləri**. *Elektrik işıq mənbələri, qövs və közərmə lampaları XIX əsrin ikinci yarısında ixtira edilmişdir.*

**QÖVSİ** *sif.* [*ər.*] Qövs şəklində olan. [Səttarxanın] *əymə və qövsi qaşları qalxır*(*dı*). M.S.Ordubadi.

**QÖVSİ-QÜZEH** *is.* [*ər.*] Günəş şüalarının havadakı yağış damcılarından keçərkən sınması nəticəsində göydə görünən rəngarəng yarımdairə şəkilli qurşaq; göy qurşağı, qarınənə örkəni. *Hər şey günəşə qurutdu yaşın; Qövsi-qüzeh açdı tər qumaşın.* Xətayi. *Bir gün* [Qadir] *qövsi-qüzehdən danışarkən, Sona cumub təmiz bir stəkan dolusu su gətirmiş*(*di*). Ə.Əbülhəsən. // Obrazlı təşbehlərdə. *Bəyaz cəbinində qövsi-qüzehtək; Hərami*

*qaşların tağı görünsün.* Q.Zakir. *Qövsi-qüzeh gözlü, ləbləri yəmən; Camalın şairə veribdir nişan.* Şair Vəli. // Qövsi-qüzehə oxşar rəngarəng şey haqqında. *Havada yavaş-yavaş qövsi-qüzeh düşür kimi Münəvvərin çöhrəsi rəngarəng olmaqdadır.* M.S.Ordubadi.

**QÖVSŞƏKİLLİ** b a x **qövsvari**.

**QÖVSVARİ** *sif.* Qövsə oxşar, qövs şəklində. *Sərvkimilər fəsiləsinin .. yarpaqları sadə və tam kənarlı olub, qaidəsindən ucuna doğru qövsvari və ya paralel şəkildə damarlanır.* Qədirov.

**QÖVŞƏ** *is.* Qabıq, qın.

**QRADONAÇÁLNİK** [*rus.* градоначальник] 1917-ci il inqilabından qabaqkı Rusiyada xüsusi əhəmiyyəti olan şəhərlərdə qubernator hüququnda olan polis rəisi. [Umudbəyov] *..Nikolay vaxtında nər-nər nərildəyirdi və qradonaçalnik Martınova küçədə elə bir şapalaq vurdu ki, səsi düz Peterburqa getdi.* C.Məmmədquluzadə.

**QRAF** [*alm.*] Qərbi Avropada və 1917-ci il inqilabından qabaqkı Rusiyada (knyaz ilə baron arasında orta) zadəgan rütbəsi və bu cür rütbəsi olan adam. [Əmiraslan ağa:] *..Mənim oğlum rusların knyaz, qraf, baron .. övladlarından artıq və əzizmidir?* S.S.Axundov.

**QRAFÁ** [*yun.*] Cədvəllərdə iki vertikal xətt arasındakı sütun; bölmə.

**QRAFÉM** *is.* [*yun.*] Yazılı nitqin ən kiçik vahidi; hərf.

**QRÁFİK¹** [*yun.*] Qrafika mütəxəssisi olan rəssam. *Qrafiklərin sərgisi.*

**QRÁFİK²** [*yun.*] 1. Müxtəlif proseslərin kəmiyyətcə vəziyyətinin cizgilərlə (xətlərlə) təsviri. *Hava təzyiqinin dəyişməsini göstərən qrafik.*

2. İstehsalatda, nəqliyyatda və s.-də işlərin görüləcək müddətini və normaları dəqiq göstərən cədvəl, plan. *Qrafik üzrə işləmək. Qrafikdən kənara çıxmaq. – Görmürmü ki, yel bizim qrafiki vurdu dağıtdı?* Mir Cəlal. *Gündəlik qrafikin həyata keçirilməsi haqqında siz heç düşünmüsünüzmü?* Ə.Sadıq.

**QRAFÍK³** *sif.* Qrafikaya aid olan; qrafika əsasında təsvir edilən. *Səslərin qrafik təsviri. Qrafik üsul.*

**QRÁFİKA** [*yun.*] 1. Əşyanın şəklini boyasız olaraq xətlər, cizgilər vasitəsilə çəkmə üsulu. *Qrafika əsərləri. Füzulinin qrafika üsulu ilə çəkilmiş şəkli.* // *top.* Bu üsul ilə ifa olunmuş sənət əsərləri. *Qrafika sərgisi.*

2. *dilç.* Canlı nitqin yazı işarələri ilə təsviri; yazı, yaxud çap işarələrinin, hərflərin şəkli.

**QRAFÍN** *is.* [*ital.*] Su, içki və başqa mayelər tökmək üçün şüşədən, yaxud büllurdan dar, uzunboğaz qab. *Şüşə qrafin. Büllur qrafin. – Stol üzərindəki qrafindən stəkana su töküb içdim.* A.Şaiq. *Aralığa İran adabı üzrə çay deyil, balaca zərli qrafinlərdə konyak və şirniyyat gətirdilər.* M.İbrahimov.

**QRAFÍNYA** [*rus.*] Qraf arvadı, yaxud qızı.

**QRAFÍT** [*alm.*] 1. Qurğuşun parıltısına çalar qara rəngli mineral.

2. Karandaşın içərisinə qoyulan bu mineraldan, yaxud başqa rəngli maddədən ibarət mil.

**QRAFLIQ** *is.* 1. Qraf titulu, qraf ünvanı.

2. Feodalizm quruluşunda: qraf mülkləri, qraf malikanəsi.

3. İngiltərədə, İrlandiyada, ABŞ-da, Kanadada və bəzi başqa ölkələrdə iri inzibati-ərazi bölgüsü.

**QRAM** [*fr.*] Metr ölçü sisteminin çəki vahidi (1 kub santimetr suyun çəkisinə bərabərdir).

◊ **Qram-atom** *kim. fiz.* – kimyəvi elementin, öz atom çəkisinə bərabər olan qramlarının sayı. **Qram-molekul** *kim. fiz.* – maddənin, öz molekul çəkisinə bərabər olan qramlarının sayı.

**QRAMMATİK** *sif.* Qrammatikaya aid olan, qrammatikaya əsaslanan. *Dilin qrammatik quruluşu. Qrammatik təhlil. Qrammatik qanunlar. Qrammatik xüsusiyyətlər.*

**QRAMMÁTİKA** *is.* [*yun.*] 1. Dilçilik elminin söz və cümlənin quruluşunu öyrənən və buna müvafiq olaraq iki hissədən – morfologiya və sintaksisdən ibarət olan bölməsi. *Müqayisəli qrammatika. Tarixi qrammatika.*

2. Hər hansı bir dilə xas olan sözlərin dəyişməsi və cümlə içərisində birləşməsi üsul və qaydalarının məcmusu. // Bir dilin həmin üsul və qaydalarından bəhs edən dərs kitabı. *Orta məktəblər üçün Azərbaycan dili qrammatikası.*

**QRAMMOFÓN** [*yun.*] Xüsusi lövhəciklərə (vallara) yazılmış səsləri eynən təkrar

edən borulu musiqi cihazı; borulu patefon. *Qrammofon çalmaq. Qrammofon valı. – Yanında bulunan qadınlar* .. [Gülzarı] *yayındırmaq və əyləndirmək üçün qrammofon oxudurlardı*. T.Ş.Simurq.

**QRAN¹** [*lat.*] *riyaz*. 0,062 qrama bərabər aptek çəki vahidi.

**QRAN²** *is*. [*fars*.] Bir riala bərabər İran gümüş pulu. *Eybi yoxdur, Yusif əmi, beş-altı qran hazır elə ki, verək seyidlərə*. C.Məmmədquluzadə. *Təziyyə məclisinə gələn yoxsulların hər birinə bir qran pul ehsan verilməsi qərara alınmışdı*. M.S.Ordubadi.

**QRANÁT** [*ital.*] 1. Partlayıcı top gülləsi; qumbara. ☐ **Əl qranatı** – əl ilə atılan kiçik qumbara.

2. *idm*. Yüngül atletikada: uzağa və ya hədəfə atılan idman aləti.

**QRANATATAN** *is. hərb*. Qranat atmaq üçün silah.

**QRANÍT** [*ital.*] Çox bərk süxur (daş). *Daş qayaya baxdım, dedim: qranitin nə bərkdir; Dedi: sənin tanklarından mənim daşım köyrəkdir.* R.Rza. // Qranitdən düzəldilmiş, tikilmiş. *Mirzə qəbiristanlığa nəzər saldı... Adamboyu başdaşılar, qranitdən yonulmuş büstlər, dəmirdən şəbəkə hasarlar...* İ.Məlikzadə. // Müqayisələrdə möhkəmlik, sarsılmazlıq, davamlılıq, bərklilik mənasında. *Aslan qranit külçəsi kimi ağır və güclü idi*. M.İbrahimov.

**QRANLIQ** *is*. Saylarla birlikdə qranın miqdarını bildirir. *Düyünçədə ağır günlər üçün saxlanılmış on dənə iki qranlıq pul vardı.* P.Makulu.

**QRANT** "Kran" sözünün danışıq dilində işlənən forması. *İki qrantdan su şırıltı ilə tökülürdü iki hovuza.* C.Məmmədquluzadə. *Salmanova qrantın altında əlini yudu*. Ə.Əbülhəsən.

**QRANUL** *is*. [*lat.*] Dənəvərləşdirilmiş qatışıq yem.

**QRAVİTÁSİYA** *is*. [*lat.*] *fiz*. Ümumdünya cazibəsi.

**QRAVÜRA** [*fr.*] Hər hansı bir bərk materialın (metal, ağac, şüşə və s.) hamar üzündə qazılmış və ya aşındırılmış şəkil, naxış. // Üzərində şəkil qazılmış və ya aşındırılmış lövhə.

**QRAVÜRAÇI** *is*. Qravüra ustası.

**QRÉYDER** [*ing.*] *tex*. 1. Yol saldıqda, yaxud təmir etdikdə torpaq laylarını kəsib kənara çəkmək, habelə suvarma kanalları çəkmək və s.-də istifadə edilən çarxlı qoşma maşın. *Maşın-meliorasiya dəstəsi yaradılmış və onun ixtiyarına iki qreyder verilmişdir.* (Qəzetlərdən).

2. Qreyderlər vasitəsilə düzəldilmiş yol.

**QREYDERÇİ** *is. xüs*. Qreyder maşınında işləyən fəhlə. *Qreyderçilər arasında yarış genişlənmişdi*.

**QRÍFEL** [*alm.*] Daşaoxşar xüsusi materialdan düzəldilmiş yazı taxtası üzərində yazmaq üçün daş qələm.

**QRİM** [*ital.*] Aktyorun səhnədə ifa edəcəyi rola görə üzünə lazımi şəkil verməsi üçün işlədilən vasitələr (boyalar, bığ, saqqal, saç və s.). ☐ **Qrim eləmək (etmək)** – bax **qrimləmək**. [Mazandaranski:] *Oqtay elə bir qrim eləmiş ki, nə deyim.* C.Cabbarlı. *Paltarlar hazır olandan sonra hərə öz bacardığı kimi qrim edirdi*. S.Rəhman.

**QRİMÇİ** *is*. Qrim hazırlayan və qrimləmə işində aktyora kömək edən teatr işçisi; qrim mütəxəssisi.

**QRİMLƏMƏ** "Qrimləmək"dən *f.is.*

**QRİMLƏMƏK** *f.* Qrim vasitəsilə üzünə lazımi surət vermək. *Artistləri qrimləmək*.

**QRİMLƏNMƏ** "Qrimlənmək"dən *f.is.*

**QRİMLƏNMƏK** *qayıd*. Üzünə qrim vurmaq. *Artist güzgünün qabağında oturub qrimlənir*.

**QRİMLƏNMİŞ** *f.sif.* Üzünə qrim vurmuş. *Qrimlənmiş artistlər*.

**QRİMLƏTMƏK** *icb.* Qrim vurdurmaq.

**QRİMLİ** *sif.* Üzündə qrim olan, üzünə qrim vurmuş.

**QRİP** [*fr.*] *tib*. Nəfəs yollarının iltihabı, qol və qıçların ağrıması, əzginlik və s. şəklində təzahür edən çox yoluxucu xəstəlik. *Qrip ilə mübarizə*.

**QRİPLİ** *sif.* və *is.* Qrip xəstəliyinə tutulmuş (adam).

**QROSSMÉYSTER** [*alm.*] Şahmat ustalarına verilən yüksək ad və bu adı almış şahmatçı.

**QROSSMEYSTERLİK** *is. şahm*. Qrossmeyster adı.

**QRUP** *is.* [*alm.*] 1. Bir yerdə, bir-birinə yaxın olan bir neçə adam, heyvan, şey və s.; dəstə. *Bir qrup adam.* // Bir neçə adamın qrafik təsviri, yaxud birgə fotoşəkli. *Qrup ilə şəkil çəkdirmək.*

2. Siyasi görüşləri, məqsədləri, peşələri və s. bir olan adamlar birləşməsi (dəstəsi). *İctimai qruplar. Ədəbi qruplar. Təbliğatçılar qrupu. Desant qrupu.*

3. Elmi təsnifatda: ümumi sistemin hissəsi, qismi, şöbəsi. *Elmlər qrupu. Bitki maddələri qrupu.*

4. Birgə məşğələ üçün birləşmiş bir neçə adamdan ibarət dəstə. *İngilis dilini öyrənənlər qrupu.*

**QRUPBAZ** *is.* [*alm.* qrup və *fars.* ...baz] Qrupbazlıqla məşğul olan adam; dəstəbaz.

**QRUPBAZLIQ** *is.* Ümumi mənafe ziddinə olaraq məhdud bir qrupun mənafeyini müdafiə etmə; hər hansı bir kollektivin işində vəhdət olmaması, dəstələrə ayrılma; dəstəbazlıq.

**QRUPCUQ** *is.* Kiçik qrup, balaca qrup, balaca dəstə.

**QRUPLAŞDIRILMA** "Qruplaşdırılmaq"-dan *f.is.*

**QRUPLAŞDIRILMAQ** *məch.* Qrup-qrup düzəldilmək, qruplar şəklində birləşdirilmək, dəstə-dəstə edilmək; təsnif edilmək.

**QRUPLAŞDIRILMIŞ** *f.sif.* Qrup-qrup düzəldilmiş, qruplar şəklində birləşdirilmiş, dəstə-dəstə edilmiş; təsnif edilmiş.

**QRUPLAŞDIRMA** "Qruplaşdırmaq"dan *f.is.*

**QRUPLAŞDIRMAQ** *f.* Qrup(lar) halında birləşdirmək, qrup-qrup düzmək, yerləşdirmək; dəstələmək, dəstə-dəstə etmək; təsnif etmək.

**QRUPLAŞMA** 1. "Qruplaşmaq"dan *f.is.* *Mütləqiyyətin yıxılması ilə əlaqədar olaraq, Şehli kəndində qruplaşmalar gedirdi.* S.Rəhimov.

2. B a x **qrup** 2-ci mənada.

**QRUPLAŞMAQ** *f.* Qrup-qrup olmaq, dəstə-dəstə olmaq, qruplar şəklində birləşmək, toplaşmaq. *Hər tərəfdə atlı və piyada qoşun dəstələri dolaşır, hər tində qruplaşmış jandarm və polis dəstələri gəzirdi.* M.S.Ordubadi.

**QU, QU QUŞU** *is.* 1. Ördək fəsiləsinə mənsub ağ (nadir hallarda qara) yumşaq tüklü, uzun boyunlu, gözəl iri su quşu; sona. *Qara qu. – Qeyr ilə yarım gedir, gərdən çəkib bir qu kimi; Qalmışam viranələr küncündə mən bayqu kimi.* S.Ə.Şirvani.

2. Qu tükündən hazırlanmış. *Qu balış. – Nuşu iki qu balışı, sabun köpüyü kimi şişirdib, çarpayının ortasına qoydu.* Ə.Əbülhəsən. *Yasavulbaşının altındakı döşək, dirsəkləndiyi balış .. zərif qu tükündən idisə də, o yenə dincələ bilmirdi.* M.Rzaquluzadə.

**QUÁŞ** *is.* [*fr.*] 1. Qeyri-şəffaf sulu rəng.

2. Həmin rəng ilə çəkilən şəkil.

**QUBA, QUBA-QAZ** *is. şair.* Vəhşi qaz. *Sona tək silkinib gərdən çəkəndə; Bənzəyirsən quba-qaza, Müşkünaz!* Aşıq Ələsgər. *Göllər üstə seyrə çıxmış sonalar; Qatarlaşıb quba-qaz gəlib gedir.* Çoban Əfqan. *Bir qıy vurram, göydən gedən quba-qazlar qanad salar.* R.Rza.

**QUBAR** *is.* [*ər.*] 1. *klas.* Toz, torpaq.

2. *məc.* Kədər, dərd, qəm, qüssə. *Getdi o köhnə qubari ki, gözümdə var idi.* Heyran xanım. *Zülmətin yer üzünü qaplaması; Qəlblərdə oyandırırdı qubar.* C.Cabbarlı. *Keçər ürək dərdi, könül qubarı; Gəl etmə meydançada cövlan, ayrılıq.* N.Rəfibəyli. □ **Qubar bağlamaq** – b a x **qubarlanmaq**. **Qubar etmək (eyləmək)** – kədərləndirmək, qəmləndirmək, dərdləndirmək. *Göz yaşı tökdükcə könül; Dəxi də çox qubar eylər.* Q.Zakir. *İndi Mədəd muzdur şərtnamələrini xatırladıqca, onun ürəyində qubar etməyə başlayırdı.* S.Rəhimov. **Qubar olmaq** – böyük dərd olmaq. *Kədərin toplanıb qubar oldu; Nazənin cisminə məzar oldu.* A.Səhhət.

**QUBARLANMA** "Qubarlanmaq"dan *f.is.*

**QUBARLANMAQ** *f.* Son dərəcə kədərlənmək, qəmlənmək, qüssələnmək. *Onun əlindən ürəyim qubarlandı.*

**QUBARLATMA** "Qubarlatmaq"dan *f.is.*

**QUBARLATMAQ** *icb.* Son dərəcə kədərləndirmək, qəmləndirmək, qüssələndirmək.

**QUBARLI** *sif.* Dərdli, kədərli, qəmli, ürəyi dərdli. *Dərdli, qubarlı aşıq; Gəlib görünür yenə.* M.Rahim.

**QUBERNÁT** "Qubernator" sözünün vaxtı ilə canlı danışıq dilində işlənmiş forması.

*Ərzə verdim keçən qubernatə; Keçmədi, heyf, ərzə isbatə.* S.Ə.Şirvani. *..Əgər sizə bir milyon da pul verələr, ya qubernat siz ilə əl-ələ versə, siz yenə mütəvəlliliyi qəbul etməzsiniz.* C.Məmmədquluzadə. *Qalanın dibində yıxıldım yatdım; Qubernat gələndə sıçradım qalxdım*. "Qaçaq Nəbi".

**QUBERNÁTOR** [*lat.*] *tar.* 1. 1917-ci il inqilabından əvvəl Rusiyada quberniya (vilayət) rəisi; vali. *Qubernator həmişə deyərdi: "Poçt yolundakı çaparxanaların hər birində Rəhim bəy kimi mənim bir adamım olsa, yolda heç bir çapqın olmaz, qurd qoyun ilə otlar*". Ə.Haqverdiyev. *Bakı qubernatoru .. Bakı varlıları və Bakı qoluzorbaları ilə görüşmək və vidalaşmaq qərarına gəlmişdi.* M.S.Ordubadi.

2. ABŞ-ın hər bir ştatında və Latın Amerikası respublikalarında yüksək inzibati vəzifə sahibi.

**QUBERNATORLUQ** *is. tar.* 1. Qubernator (vali) vəzifəsi.

2. Qubernatorun (valinin) idarəsi altında olan vilayət.

**QUBÉRNİYA** [*lat.*] Çar Rusiyasında və rayonlaşmadan qabaq SSRİ-də əsas inzibati-ərazi vahidi; vilayət. *..Bunu biz bilirik ki, Gəncə quberniyasının aclarından ötrü keçən il Bakıda ianə cəmiyyəti quruldu*. C.Məmmədquluzadə.

**QUCAQ** *is.* 1. Qolları açdıqda döş ilə qollar arasında əmələ gələn boşluq. *Bayram aşağı əyildi, yerə sərilmiş fəhlələrdən birini qucağına alıb ortadan çıxartdı..* M.Hüseyn. *Qaraca çoban yaralı qardaşını qucağına alıb tayaya tərəf apardı.* M.Rzaquluzadə. ☐ **Qucağı uşaqlı** – qucağında körpə uşağı olan. *Qucağı uşaqlı arvadlardan bir neçəsi özündən gedib, qarın üstünə sərilmişdi.* Çəmənzəminli. // Mehribanlıq və nəvaziş üçün birini qucaqlamaqdan ötrü açılmış qolların tutduğu vəziyyət; ağuş. *Qucağına atılmaq*. – *Doktor onu qucağına alıb alnından öpər və konfetə qonaq edərdi.* M.İbrahimov. *Baba da cücəli toyuq kimi onlara dil tökür, qucağına alır.* Mir Cəlal. // Məc. mənada. *Bir də dilimizdə Vətən sözü var! Ana qucağıdır bu ilahi söz*. S.Vurğun. *Ayna sular qucağında görünür; Div gövdəli, qara üzlü qayalar*. R.Rza. *Ulduzlar sönüb gedir göylərin qucağına*. Ə.Cəmil. "*Sual*" *romanında çoban həyatını, gözəl mənzərələri təsvir edən Asəf Zeynallı xoş və gözəl təbiət qucağında yaşayan insan varlığındakı mənanı oxşayır*. Ə.Bədəlbəyli.

2. Adətən "bir" sözü ilə: **bir qucaq** – 1) qollarının arası tutduğu qədər. [Atakişi:] *İndi, qızım, mənim təsəllim bu bir vedrə su, bir qucaq odundur, onu da mənim əlimdən almayın*. C.Cabbarlı; 2) *məc.* çoxlu, çox. *Məndə sənin bir qucaq sirrin var..* M.Hüseyn.

**qucaq-qucaq** *zərf* Çox, lap çox, çoxlu miqdarda, bollu, bol-bol. *Adsız ölən igidlərin o pərişan məzarına; Çiçək səpir qucaq-qucaq, gül dağıdır ətək-ətək.* S.Vurğun.

**QUCAQLAMA** "Qucaqlamaq"dan *f.is.*

**QUCAQLAMAQ** *f.* 1. Nəvaziş və mehribanlıq əlaməti olaraq birini qolları arasına alıb döşünə basmaq, ağuşuna almaq. *Ana uşağını qucaqladı. – Məcid ..* [Nadirin] *bu cür tutulduğunu görüb ayağa qalxdı və uca səslə qarşılayaraq qucaqlayıb öpdü*. B.Talıblı. *Güman edirəm ki, ömrümdə anam bu qədər səmimiyyətlə məni qucaqlamamışdır.* Qantəmir. *Gün gələr yenə də biz tapışarıq; Qucaqlar hər ana qalib oğlunu*. R.Rza. // Qolları arasına almaq. *Böyükxanım bir tərəfdə dizlərini qucaqlayıb fikir edirdi*. M.S.Ordubadi.

2. *məc.* Bərk-bərk yapışmaq, tutmaq. *Dağların ardı-arası kəsilmir, zəncir kimi bir-birinə hörülmüş, bir-birini qucaqlamış kimi durur*. A.Şaiq.

**QUCAQLANMA** "Qucaqlanmaq"dan *f.is.*

**QUCAQLANMAQ** *məch.* 1. Qollar arasına alınmaq, ağuşa alınmaq.

2. *məc.* Əhatə olunmaq, dövrələnmək. *Bu yer qalın, sıx meşəlik, çılpaq qayalıq uçurumlu dərələrlə qucaqlanmışdı.* A.Şaiq.

**QUCAQLAŞMA** "Qucaqlaşmaq"dan *f.is.*

**QUCAQLAŞMAQ** *qarş.* 1. Bir-birini qucaqlamaq, bir-birinə sarılmaq, bir-birini bağrına basmaq; qol-boyun olmaq. *İki qardaş bir-birini görüncə qucaqlaşdılar. – İllər ayrısıyam, gəl qucaqlaşaq; Sevdiyim, şikayət zamanı deyil.* Q.Zakir. *Məscidin içində bunlar qucaqlaşdılar və başladılar ağlamağa*. Ə.Haqverdiyev. [Tapdıq:] *Bəs elə isə gəl ağuşuma, qucaqlaşalım*. C.Cabbarlı.

2. *məc.* Qovuşmaq, bitişmək, birləşmək. *Yenə də xırdaca ağ buludların ay işığı ilə qucaqlaşan kölgələri .. Xəzərin dərin hovuzunda çimmək üçün enir.* M.S.Ordubadi. *Getgedə hava daha da qaranlıqlaşırdı, sanki yerlə göy qucaqlaşırdı.* M.Hüseyn.

**QUCMA** "Qucmaq"dan *f.is.*

**QUCMAQ** b a x **qucaqlamaq**. *Yalançı nəfsə uymuşsan, qucursan dünyanı nədir?* Nəsimi. *Nola mən divanə qucsam sən pərini hər gecə.* Kişvəri. *Döndüm əğyar əlindən; Can qurtardım felindən; Qızıl kəmər olaydım; Qucaydım yar belindən.* (Bayatı). *Dizlərimi qucub tənha əyləşmək çoxdan adətimdir.* N.Vəzirov. // Dövrələmək, əhatə etmək. *İnsanı kainat qucdu.* A.Divanbəyoğlu. *Sarban kəndinin belini iki tərəfdən qucmuş Laçın dağından sazaq başlamışdı.* M.Hüseyn.

**QUCU** *uş. dil.* Balaca uşaqları qucağa çağırarkən deyilən söz. *Gəl qucuma!*

**QUCULMAQ** b a x **qucaqlanmaq**.

**QUCUM** *is. xüs.* Bir şeyin dairəsinin ölçüsü, uzunluğu. *..At fermalarında yetişdirilmiş və cıdır sınaqlarından keçmiş Qarabağ tipli 13 baş ayğırın orta hesabla .. döş qucumu 157 sm-dir.* Səttarzadə. *Dayçaların inkişafı onları qapanda çəkmək, .. hündürlüyünü, döş qucumunu, ayaq darağı qucumunu ölçmək yolu ilə yoxlanır.* "Zootexniya".

**QUCUMAQ** b a x **qucaqlamaq**.

**QUDA** *is.* Gəlin ilə oğlanın ata-analarının bir-birinə olan qohumluq münasibəti. *İki quda ötə-bəridən məhəbbətlə danışdılar.* A.Şaiq. *Gəlin qayınananın xoşuna gələrdi. Qayınana qudaları qonaq edərdi.* H.Sarabski. ☐ **Quda olmaq** – b a x **qudalaşmaq**. *Dürsədəf xanım gülə-gülə dedi: – Səninlə quda olmağa nə sözüm ola bilər!* A.Şaiq.

**QUDALAŞMA** "Qudalaşmaq"dan *f.is.*

**QUDALAŞMAQ** *f.* Bir-birinə quda olmaq; qız almaq və ya qız verməklə biri ilə qohum olmaq.

**QUDALIQ** *is.* Quda olma; oğul evləndirmək və ya qız vermək nəticəsində əmələ gələn qohumluq əlaqəsi.

**QUDÓK** *is.* [*rus.*] Fit, uğultu, fit səsi. *Təşkilat* [çar] *hökumət məmurlarını azdırmaq fikri ilə, o gün bir-birindən az fasiləli olaraq bütün mədənlərdə qudok çalmağı qərara almışdı.* A.Şaiq. *Qudokun səsindən canlanan sürət; Andırırdı sağlam, polad bir qəlbi.* S.Vurğun.

**QUDRÓN** [*fr.*] *tex.* Mazut qalıqlarından istehsal edilən, başlıca yol tikilişində və s.-də işlədilən qara qatran maddəsi. *Mazutdan sürtkü yağları alındıqdan sonra, qalıq olaraq qatran kimi kütlə – qudron alınır, bundan küçələrə döşənən material kimi istifadə edilir.* "Kimya". // Neftayırma zavodlarında alınan qalıqlar (xüsusi sürtkü yağları və s. istehsalı üçün xam maddə kimi işlənir).

**QUDRONLAMA** *xüs.* "Qudronlamaq"dan *f.is.*

**QUDRONLAMAQ** *f. xüs.* Qudronla örtmək, qudron döşəmək (salmaq). *Yolları qudronlamaq.*

**QUDRONLANMA** "Qudronlanmaq"dan *f.is.*

**QUDRONLANMAQ** *məch. xüs.* Qudronla örtülmək, qudron döşənmək (salınmaq).

**QUDRONLANMIŞ** *f.sif. xüs.* Qudronla örtülmüş, qudron döşənmiş (salınmış). *Qudronlanmış şose.*

**QUDRONLU** *sif.* Qudron qatışıqlı, tərkibində qudron olan.

**QUDURĞAN** *sif.* Azğın, həddini azmış, qudurmuş; harın. *..Qudurğan dövlətli cavanları arvada latayıl söz qoşub oxuyur, onu biabır edirdilər.* Ə.Əbülhəsən. // *İs. mənasında.* Söyüş yerində işlənir. [Xan:] *Qudurğanın boynunu sındırarlar! – dedi. Rəhmətlik atam o qudurğanların kəllələrindən Xaçında minarə tikdirdi.* Çəmənzəminli. [Soltan bəy:] *Qudurğanın birisi, bir sillə çəkərəm ki, dişlərin qarnına gedər.* Ü.Hacıbəyov.

**QUDURĞANCASINA** *zərf* Qudurğan adam kimi, azğıncasına, həyasızcasına.

**QUDURĞANLAŞMAQ** *f.* Qudurğan olmaq, azğınlaşmaq, qudurmaq, həddini azmaq, cızığından çıxmaq; harınlaşmaq, həyasızlaşmaq.

**QUDURĞANLIQ** *is.* Qudurma, həddini aşma, cızığından çıxma, azğınlıq; həddindən artıq lovğalıq, həyasızlıq; harınlıq; qudurğancasına hərəkət. [Cümşüd:] *Bilirsən ki, bu başıbatmış dörd məlik mənim atamla da düşmənçilik ediblər.. Qudurğanlıq edirlər.* Çəmənzəminli. *Muzdurlar komitəsi bu qudurğanlığı haman Piridən və həmkarlarından görürdü.* Mir Cəlal.

**QUDURMA** "Qudurmaq"dan *f.is.*

**QUDURMAQ** *f.* 1. Quduz olmaq, quduzluq xəstəliyinə tutulmaq.

2. *məc.* Son dərəcə hiddətlənmək; hirsindən, acığından özünü itirmək dərəcəsinə gəlmək. *Şişman adam artıq büsbütün quduraraq əsəbi hallar keçirirdi.* A.Şaiq.

3. *məc.* Coşmaq, tüğyana gəlmək, şiddətlənmək. *Çırpınırkən xilas üçün həpimiz; Daha dəhşətlənib qudurdu dəniz.* H.Cavid.

4. *məc.* Azğınlaşmaq, həddini aşmaq, cığırdan çıxmaq; hərəkətində, danışığında hədd-hüdudu aşmaq. *Ədə, qardaş, vallah, sən qudurubsan, sən heç özün də bilmirsən ki, nə danışırsan.* C.Məmmədquluzadə. *Kazım ilə söhbətdən sonra müdir onun adını qaraladı və ürəyində bunu da dedi: – Üz vermək lazım deyil, qudurar*. Mir Cəlal. // Lovğalanmaq, tay-tuş tanımamaq, özünü yüksək tutmaq (var-dövlət və ya mənsəb sayəsində).

**QUDURMUŞ** 1. *f.sif.* Quduzluq xəstəliyinə tutulmuş, quduz olmuş. *Qudurmuş it.* – [Molla bacı:] *Paxıllıqdan qudurmuş itə dönüb yan-yörəni dalayırsan*. Çəmənzəminli.

2. *is. məc*. Azğın, coşmuş, həddini azmış adam haqqında (bəzən söyüş kimi işlənir).

**QUDURMUŞCASINA** b a x **quduzcasına**.

**QUDURTMA** "Qudurtmaq"dan *f.is.*

**QUDURTMAQ** *f.* Öz hərəkətləri ilə birinin qudurmasına, həddini azmasına, həyasızlaşmasına səbəb olmaq; harınlaşdırmaq, başa çıxartmaq. [Ziba xanım:] *..Axır işi o yerə yetiribsən ki, mənim qaravaşımı söyüb mənim üstümə göndərirsən. Vəzir səni belə qudurdubdur?* M.F.Axundzadə. // Qızışdırmaq.

**QUDUZ** *sif.* 1. Quduzluq xəstəliyinə tutulmuş; qudurmuş. *Quduz it. Quduz canavar. Quduz olmaq* (*quduzluq xəstəliyinə tutulmaq*). – *Ələmdar quduz it kimi mırıldana-mırıldana aşağıya düşüb, faytonun yanında dayandı.* S.Rəhimov.

2. *məc.* Azğın, zalım, qəddar, qudurğan, qızmış. [Gövhər xanım:] *Qurban olum, qardaş! Bunlar çox quduz adamdırlar, sərhesab ol.* N.Vəzirov. *Quduz düşmənin qılıncı cəngavərin qolunu kəsib atdı*. M.Hüseyn. *O bizim tankçılardır; Bir anda qan uddurar; Azğın, quduz düşmənə.* M.Seyidzadə. // *məc.* Şiddətli, hədsiz, önüalınmaz. *..Düşmən quduz bir kinlə ətrafını gəmirib dalayır*. Ə.Məmmədxanlı.

**QUDUZCASINA** *zərf* Azğıncasına, vəhşicəsinə, amansızcasına; quduz kimi. *Quduzcasına üzərinə atılmaq.*

**QUDUZLAŞDIRMA** "Quduzlaşdırmaq"-dan *f.is.*

**QUDUZLAŞDIRMAQ** *f.* Daha da qızışdırmaq, daha da hiddətləndirmək, daha da qəzəbləndirmək.

**QUDUZLAŞMA** "Quduzlaşmaq"dan *f.is.*

**QUDUZLAŞMAQ** *f.* 1. Quduz olmaq, quduzluq xəstəliyinə tutulmaq.

2. *məc.* Daha da azğınlaşmaq, qudurmaq, şiddət göstərmək, quduz heyvana dönmək.

**QUDUZLUQ** *is.* 1. Quduz heyvanın dişləməsi nəticəsində sinir sistemini iflicə uğradan ağır yoluxucu xəstəlik. *Quduzluğa qarşı aşı. Quduzluğun yayılmasının qarşısını almaqdan ötrü quduz və avara itləri məhv edirlər.* // Bu xəstəliyə tutulmuş heyvanın və ya adamın halı.

2. *məc.* Dəlilik, azğınlıq, vəhşilik, zalımlıq.

**QUDUZOTU** *is. bot.* Kolluqlarda, quru dağ yamaclarında bitən çoxillik ot bitki.

**QUĞU** b a x **quq-qu**.

**QUĞULDAMA** 1. "Quğuldamaq"dan *f.is.*

2. *is.* Göyərçinin çıxardığı səs.

**QUĞULDAMAQ** *f.* Göyərçin kimi səs çıxarmaq. *Göyərçin quğuldayır*.

**QUQQU, QUQQU QUŞU** *is. zool.* Adətən özünə yuva tikməyib, özgə quşların yuvasında yumurtlayan, boz, çil-çil, uzunquyruq meşə quşu. *Quqqu quşu göyərçin böyüklükdə bir quşdur; o, hər 3-4 gündən bir balaca yumurta yumurtlayır və bu yumurtanı kiçik quşların yuvasına qoyur*. "Zoologiya".

**QUQ-QU** *təql.* Quqqu kimi quşların çıxardığı səs.

**QUQQULDAMA** "Quqquldamaq"dan *f.is.*

**QUQQULDAMAQ** *f.* 1. Quq-qu səs çıxarmaq. *Turac quqquldayır. Alabaxta quqquldayır*.

2. Xoruz kimi səs çıxarmaq, banlamaq, quq-qu eləmək. *Kəblə Hətəm xan qırmızı cığalı xoruz kimi quqquldadı.* S.Rəhimov.

**QUQQULDAŞMA** "Quqquldaşmaq"dan *f.is.*

**QUQQULDAŞMAQ** *qarş*. Ağız-ağıza verib quqquldamaq.

**QUQQULTU** *is.* Turac, alabaxta kimi quşların çıxardığı səs.

**QUQ(Q)ULU** *is. məh.* 1. Bütöv çıxarılmış qoz içi, ləpələri ayrılmamış qoz.

2. Bütöv halda çıxarılmış nar içi.

**QUQ-QULU-QU** *təql.* Xoruz banlaması, xoruzun çıxardığı səs. *Gördü ki, bir xorusi-rənginmu; Eyləyir bir ağacda quq-qulu-qu.* S.Ə.Şirvani.

**QUQURD** *is. məh.* Açılmamış qızılgül; qönçə.

**QUL[1]** *is.* 1. Qədim dövrlərdə: müharibədə əsir tutulub satılan adam. *Neçə qul azad elədim; Qəsd etmədim cana, Nigar!* "Koroğlu".

2. Xidmət üçün satın alınmış adam; hər cür istehsal vasitəsi və hüquqdan məhrum olan və tamamilə öz sahibinin ixtiyarında olub, bir mal kimi alınıb satılan adam; kölə. *Spartakın rəhbərliyi altında qədim Romada qulların üsyanı olmuşdu. – Sərir hökmdarı rəiyyətini öz qulu hesab edərdi.* A.Bakıxanov. *Cəllad yanıb od olsa da, külə dönməz arzular; Təbiətin ana qəlbi qul doğmamış insanı!* S.Vurğun. // *köhn.* Nökər, xidmətçi. *Bir xidmət edən qulam sənə mən.* Xətayi. [İskəndər:] *İndi mən sənə nökərəm, mən sənə qulam, gəl, gəl barışaq.* C.Məmmədquluzadə. *Hər qəhrəmanın qulu meydanın arxasında ağası üçün ehtiyat atlar saxlamışdı.* M.S.Ordubadi. □ **Qul etmək** *məc.* – əsir etmək, valeh etmək, tamamilə ixtiyarını əlindən almaq. *Götür niqabı və xalqı qul eylə hüsnünə kim; Məlahət əhlinə sənsən əmirü, sənsən şah.* Nəsimi. **Qul olmaq** – tabe olmaq, boyun əymək.

3. *məc.* Öz iradəsini, hərəkətlərini tamamilə bir şeyə, ya başqasına tabe etmiş adam. *Öz adətlərinin qulu.*

**QUL[2]** *is.* Tənha yerlərdə və qaranlıqda vahiməyə düşən adamın gözünə canlı kimi görünən qorxunc xəyal; qulyabanı.

**QULA** *is. məh.* Açıq-sarı rəngli at. *Qula madyan.*

**QULAĞAGİRƏN** *is.* 1. B a x **qırxayaq** 1-ci mənada.

2. *məc. dan.* Hər kəsdən söz bilməyə, söz çəkməyə çalışan adam; xəbəraparan, casus.

**QULAQ** *is.* 1. İnsan və heyvanlarda eşitmə orqanı. *Qulağı ağrımaq. Qulaq həkimi. – Nəvəsi onun .. burnundan, qulağından yapışır, boğazının altını qıdıqlayır.* M.Rzaquluzadə.

2. Qulaqları örtmək üçün papağın yanlarından sallanan hissəsi. *Papağın qulaqlarını salmaq.*

3. Bir şeyin qırağı, yanı, kənarı, ucu. *İkincisi, mən ömrüm olanı səndən savayı bir qadına gözümün qulağı ilə də baxmayacağam.* Ə.Haqverdiyev. *Günəşin qulağı batdımı, kimsə bu mədənin yanından keçə bilməzdi.* A.Şaiq. *Məmməd bəy dinmirdi, düşüncə içində gəlib körpünün qulağında oturdu.* Çəmənzəminli. // "Bir" sözü ilə: bir tikə, bir parça, bir qırıq, bir az, azacıq, cüzi. *Kişi çörəkdən bir qulaq qoparıb etinasız və hətta acıqlı bir hərəkətlə yerə atdı.* M.İbrahimov. *Hər nə varsa, bir qulaq gətir, iştahadan yaman kəsilmişəm.* S.Rəhimov. *Arvadlar qəzeti o qədər dartışdırdılar ki, bir qulağı qırıldı.* Mir Cəlal.

4. Arabada: oxların təkərdən kənara çıxmış ucu. *Arabanın qulağı sındı. – Kəndin küçələrindən birində tini burulanda heç gözlənilmədən arabanın taxta oxunun qulağı divara toxunub* (*sındı*). H.Sarabski.

◊ **Bir qulağından alıb, o biri qulağından çıxartmaq,** yaxud **bu qulağından vurub, o qulağından keçirmək** – eşidərək əməl etməmək, deyilən sözə əhəmiyyət verməmək, tapşırılan sözü, işi, təklifi yerinə yetirməmək, vecinə almamaq, saymazlıq göstərmək. *Tükəzban bunlara bilmərrə fikir verməyib, dalınca söylənən sözləri də eşidəndə bu qulağından vurub, o qulağından keçirərdi.* B.Talıblı. **Qulağa girmək** *məc.* – bir şey bilməyə, söz çəkməyə çalışmaq. **Qulağı ağır olmaq** – 1) ağır eşitmək, yaxşı eşitməmək; 2) işdə kahal və tənbəl olmaq, səhlənkar olmaq. **Qulağı batmaq** – kar olmaq, eşitməmək. **Qulağı cingildəmək** – 1) qulağında zəng səsi kimi bir səs eşitmək; 2) sözünün başqası tərəfindən danışıldığını hiss etmək. **Qulağı çəkilmək** – tənha və uzaq bir yerdə qalıb darıxmaq, qəribsəmək, ürəyi qısılmaq, könlü sıxılmaq. **Qulağı dəng olmaq** – səs-küydən təngə gəlmək, səsdən təngişmək. **Qulağı dinc olmaq** – rahat, asudə, sakit, qeydsiz-qayğısız olmaq, canı rahat olmaq. *İnsanın əvvəl-qabaqca düşməni olmasa, söz yox ki, qulağı dinc olar..* C.Məmmədquluzadə. **Qulağı dincəlmək** –

rahat olmaq, asudələşmək, qeyddən-qayğıdan azad olmaq, heç bir şeyin dərdini çəkməmək. **Qulağı dolmaq** – bir şeyi çox eşitməkdən ona adət etmək, öyrəşmək, inanmaq. **Qulağı ... olmaq** – birinin danışdığı sözlərə diqqətlə qulaq asmaq, bir sözünü qaçırmamaq. *Xanın gülər gözləri Ömər xanın gözlərinə dikilmişdi. Vaqifin də qulağı onda idi*. Çəmənzəminli. **Qulağı səsdə olmaq** – bir şeyin intizarında olmaq, bir xəbər gözləmək. **Qulağı səsə düşmək** – heç bir səs olmadığı halda, qulağına səs gəlmək. *Gülpəri qulağının səsə düşdüyünü güman edib, yerinə uzanmaq istərkən, eyni zəif taqqıltı yenə eşidildi*. M.Hüseyn. **Qulağına arı vızıltısı kimi gəlmək** – heç bir əhəmiyyət verməmək, qətiyyən saymamaq, vecinə almamaq. **Qulağına barmaq tıxamaq** – qulaq asmaq istəməmək, qulaq verməmək, eşitməməyə çalışmaq, eşitmək istəməmək. **Qulağına batmaq** – təsir etmək. *Bizə aşkardır ki, yazdığımız mətləblər avamın qulağına batmaz və bata bilməz.* C.Məmmədquluzadə. **Qulağına çatdırmaq** – bir sözü, ya xəbəri hər hansı bir vasitə ilə eşitdirmək, bildirmək, xəbər vermək. **Qulağına çatmaq** – bir sözü, ya xəbəri hər hansı bir vasitə ilə eşitmək. *Barxudarın yaxşı işlərindən danışılan sözlər qoruqçu Ağanın arvadı Bədirnisənin qulağına çatdı.* Mir Cəlal. **Qulağına dəymək** – eşitmək, eşidən kimi olmaq. *Azca keçməmiş iki atlının ayaq səsi küçədən Gülnazın qulağına dəydi.* M.İbrahimov. **Qulağına əyilmək** – qulağına söz demək. *Anam mətbəxdə qurdalanırdı. Yanlayıb qulağına əyildim*. Mir Cəlal. **Qulağına girməmək** – təsir etməmək, kar etməmək, əsər etməmək, saymamaq, əhəmiyyət verməmək. *..Bu danışıqların heç biri mənim qulağıma girmir*. C.Məmmədquluzadə. **Qulağına pambıq tıxamaq** – b a x **qulağına barmaq tıxamaq**. **Qulağına pıçıldamaq** – yavaşca və xəlvəti söyləmək, pıç-pıç danışmaq. **Qulağına söz girməmək (batmamaq)** – söz təsir etməmək, deyilən sözə qulaq asmamaq. **Qulağına yetişmək** – b a x **qulağına çatmaq**. *İki çağırım qədər getmişdik ki, uzaqda biçinçilərin oraqlarının qat-qarışıq səsləri qulağımıza yetişdi.* A.Şaiq. **Qulağında sırğa olmaq** – təcrübədən çıxmaq, imtahandan çıxmaq, bir sınaq nəticəsində ayıq və sayıq olmaq, yadından çıxarmamaq. **Qulağından çıxmaq** – yadından çıxmaq, unudulmaq. **Qulağından pambığı çıxarmaq** – ayılmaq, qəflətdən ayılmaq, düşünmək. *Çıxar pambıq qulağından, gözün aç; Ki, həşr oldu və çalındı bu gün sur*. Nəsimi. **Qulağını burmaq** – b a x **qulağını çəkmək**. **Qulağını (qulaqlarını) çəkmək** – yüngülcə cəzalandırmaq, tənbeh etmək. **Qulağını (qulaqlarını) doldurmaq** – bir fikri və s.-ni daima birinə təlqin etmək, beyninə yeritmək, inandırmağa çalışmaq. [Rəcəb:] *..Mən yavaş-yavaş Zinyət xanımın qulağını doldururam.* N.Vəzirov. *..Hacı Mir İbrahim ağa və sair ağa və mollanümalardır ki, hərəsi öz ətrafına bir dəstə yığıb, avamın qulaqlarını doldururlar ki, hər kəs onlara itaət etsə, behiştə daxil olacaq*. "Mol. Nəsr." **Qulağını sallamaq** – 1) anlamamaq, deyilən sözü qanmamaq; 2) boş-bikar durmaq, avara gəzmək. **Qulağını saza vermək** – saymamaq, bir sözə qulaq asmayıb başqa işlə məşğul olmaq. **Qulağını tutmaq** – b a x **qulağına barmaq tıxamaq**. **Qulağını tutub qaçmaq** – bir sözü və s.-ni eşitmək istəməmək, nifrət etmək. **Qulağının ardını görəndə** – heç vaxt, qətiyyən, əsla. **Qulağının dibi saralmaq** – ölümü yaxınlaşmaq. **Qulağının dibində** – lap yanında, lap yaxınlığında, yanındaca. *Atam məni qolları arasında yük üstünə uzadırkən, qulaqlarımın dibində gurlayan bir səsdən gözlərimi açdım*. A.Şaiq. **Qulağının dibini görər** – heç bir vaxt görməz, əsla görməz. **Qulaq asmaq** – 1) dinləmək. *Bir qulaq as naleyi-heyranə, hifz et naləsin; Bəzmi-hikmətdə onu əfsanə eylə, ey həkim!* Heyran xanım. *Xan .. başını pəncərədən çıxardıb, bir də qulaq asdı*. Çəmənzəminli. *Mən gedib oxuyana-çalana qulaq asıb, çox el mahnıları və muğamat öyrəndim*. H.Sarabski; 2) qulağını qoyaraq yoxlamaq, müayinə etmək. *Həkim ürəyimə qulaq asdı*; 3) gizli olaraq qulaq vermək, xəbər bilmək, dinləmək, eşitmək. *Dadaş, yarım saatdır mən sizin söhbətinizə o biri otaqdan qulaq asıram.* N.Vəzirov; 4) deyilən sözə əməl etmək, sözə baxmaq,

deyiləni qəbul etmək; // fikir vermək, əhəmiyyət vermək, saymaq. [İskəndər:] *Baş üstə, .. amma bunu de ki, mənim sözümə qulaq asan kimdir?* C.Məmmədquluzadə. [Mahmud əminin] *öz ağlı vardı və belə işlərdə öz bildiyini edirdi, bir kəsin sözünə qulaq asmazdı*. B.Talıblı; 5) qeydinə qalmaq, muğayat olmaq, fikir vermək, baxmaq. *Uşağa yaxşı qulaq as*. **Qulaq batırmaq** – 1) kar etmək, karlaşdırmaq; 2) səs-küydən dəng etmək, gurultudan təngə gətirmək. **Qulaq batmaq** – dəng olmaq, səsdən, bərk danışıqdan heç şey eşitməmək, kar olmaq. *..Qulağım batdı, nə çox-çox danışırlar*. M.Ə.Sabir. **Qulaq dincliyi** – rahatlıq. [Vəzir:] *Vəzirim mənə belə-belə qulluq buyurubdur, sonra qulaq dincliyi bizə haram olar*. M.F.Axundzadə. [Gülcamal:] *Bu bəy, bu yüzbaşı, bu divanxana; Bir qulaq dincliyi verərmi ona?* Z.Xəlil. **Qulaq kəsilmək** – diqqətlə dinləmək, diqqətlə qulaq asmaq, diqqət etmək. *Bütün nümayəndələr qulaq kəsilərək, şairin səsini eşitmək .. istəyirdi*. M.S.Ordubadi. *Başdan-ayağa qulaq kəsilərək müəllimin sözlərini diqqətlə dinləyən Həsən .. son sözləri eşidərkən bütün vücudu sarsılır kimi oldu*. A.Şaiq. **Qulaq kəsmək** – aldatmaq, aldadıb pulunu və ya başqa bir şeyini əlindən almaq, hiylə ilə birindən bir şey qoparmaq. *Aslan bəyin evlərinə baxırsan, .. o büsatlar, o bəzək, o şücaətlər hamısı adam aldatmaqdan ötrüdür və bizim kimi avam, fəqir-füqəraların qulaqların kəsməkdən əmələ gəlibdir*. N.Vəzirov. **Qulaq qabartmaq** – bildirmədən, hiss etdirmədən qulaq asmaq, gizlindən qulaq vermək. **Qulaq-qulağa** – 1) tən, bərabər; 2) yanaşı. **Qulaq olmaq** – güdmək. **Qulaq tutmaq** – qulaq asmaq, fikir vermək. *Gər sənə əfqanimi bihudə dersə müddəi; Ol sözə tutma qulaq, mən çəkdiyim əfqanə tut*. Füzuli. **Qulaq tutulmaq** – b a x **qulaq batmaq**. *Axşamlar qoyun-quzu mələşə-mələşə obaya dönərkən səsdən qulaq tutulur*. A.Şaiq. *Şəhərin hər tərəfindən alov qalxırdı, güllə və top səsindən qulaq tutulurdu*. Çəmənzəminli. **Qulaq vermək** – b a x **qulaq asmaq** 1 və 4-cü mənalarda. *Hükəmalar buyurublar: ..sözünü o kəslərə de ki, sənə qulaq verirlər*. C.Məmmədquluzadə. *Aydınlıq gecədə gözəl bir çeşmənin kənarında cavanlar halə qurub əyləşib, növbə ilə oxuyub-çalanlara qulaq verirdilər*. Ə.Haqverdiyev; // eşitməyə çalışmaq. *Ayna bir müddət uzaqdan gələn tütək səsinə qulaq verdi*. Ə.Məmmədxanlı. **Qulaqda qalmaq** – yadda qalmaq, unudulmamaq. **Qulaqda saxlamaq** – yadda saxlamaq, unutmamaq. **Qulağına qurğuşun!** – arzu edilməyən və ya adı çəkilmək istənilməyən bir şey (hadisə) haqqında danışılarkən deyilən ifadə. **Qulaqlarını (qulağını) şəkləmək** – 1) səs və s.-dən hürkərək qulaqlarını dikləmək. *Mahmud atdan yerə sıçradı. Ürkə töyşüyə-töyşüyə su içmək üçün başını irəli uzadanda silah səsindən diksinib qulaqlarını şəklədi*. M.Hüseyn; 2) *məc.* çox maraqlanmaq, bir şeyi eşitmək həvəsində olub bütün diqqətini ona vermək. *Çox adam qulağını şəkləyib durur*. A.Şaiq. **Əli qulağında** – tam vaxtında, lap vaxtında. **Yerin, divarın qulağı var** – danışarkən ehtiyatlı olmaq lazım gəldiyini bildirir.

**QULAQALTI** 1. *sif. anat.* Qulağın alt tərəfində, ya yanlarında olan. *Qulaqaltı vəzi*.

2. *is.* b a x **qulaqbalışı**. *Kosanın qaralmış kirli qulaqaltısı otaqcanın ortasına düşmüşdü*. S.Rəhimov.

**QULAQARDI** *is.* Qulağın dal tərəfi.

◊ **Qulaqardına vurmaq (vermək)** – qulaq asmamaq, qəsdən fikir verməmək, özünü eşitməməzliyə, bilməməzliyə qoymaq. [Həsən:] *Neçə dəfə ağaya demişəm, qulaq asmır. Gah da görürsən qulaqardına verir*. Ə.Haqverdiyev. *Səməd bütün deyilən sözləri qulaqardına verdi*. M.Hüseyn. *Kərim əvvəlcə bu sözləri qulaqardına vurdu*. M.İbrahimov.

**QULAQBALIŞI** *is.* Yatarkən qulaq altına qoyulan kiçik yastıqca.

**QULAQBATIRAN, QULAQBATIRICI** *sif.* Qulaqları batıracaq qədər bərk, şiddətli, gurultulu. *Qulaqbatırıcı səs. Qulaqbatırıcı gurultu. – Kənddə qulaqbatıran bir haray vardı*. M.Hüseyn. *Hacı Atakişi: – Oğul, Fərman! – deyə qulaqbatırıcı bir səslə qışqıraraq, yerindən sıçradı*. Ə.Abasov.

**QULAQBURMA(SI)** *is. dan.* Yüngül tənbeh, yüngül cəza. [Dayısı Nadirə:] *Bacıoğlu,*

*görünür, qulaqburması yadından çıxıb, ha? – deyə altı il əvvəl döyüldüyünü xatırlatdı*. B.Talıblı. □ **Qulaqburması vermək** – cəzalandırmaq, tənbeh etmək. [Mirzə Əsgər:] *Lazımdır ki, bir qulaqburması verib, sonra bir iş üstə qoyasız, bikar gəzməsin*. N.Vəzirov. *Özünü də tutub qoyacaq idilər bu şeylərin üstünə, gözəl qulaqburması verəcəkdilər*. M.S.Ordubadi.

**QULAQCIQ** *is*. Kiçik qulaq. *Balığın ürəyi iki kameradan: qulaqcıq və qarıncıqdan ibarətdir*. Cəbrayılbəyli.

**QULAQKƏSƏN** *is. dan*. 1. Sərt olmaq üçün itlərin qulaqlarını kəsməklə məşğul olan adam. *İt qulaqkəsəndən qorxar*. (Ata. sözü).

2. *məc*. Adamaldadan, hiyləgər, kələkbaz, hiylə ilə pul çəkən. *Bu göz həkimləri .. qulaqkəsən, cibkəsəndirlər, adamın cibini soyub dərdinə də əlac etmirlər*. Ə.Haqverdiyev.

**QULAQLAMA** "Qulaqlamaq"dan *f.is*.

**QULAQLAMAQ** *f. dan*. Qulağından tutmaq. *Qısraq şeydir, öküz deyil ki, qulaqlayıb cütə qoşasan*. S.Rəhimov. // Bərk yapışıb buraxmamaq.

**QULAQLAŞMA** "Qulaqlaşmaq"dan *f.is*.

**QULAQLAŞMAQ** *qarş*. 1. Bir-biri ilə xəlvəti danışmaq, pıçıldaşmaq. *..Urmi və Xoy konsulları da onlarla tez-tez danışır və qulaqlaşırdı*(*lar*). M.S.Ordubadi.

2. Bir-birinin qulağından tutub dartmaq; dalaşmaq.

**QULAQLI** *sif*. 1. Qulaqları olan (b a x **qulaq** 2-ci mənada). *Sifətini qulaqlı papaq altında gizlətmiş dəmiryolçu qarşımdan ötürdü*. Mir Cəlal.

2. Qulağa keçirmək üçün qarmağı olan. *O, alnında yerləşən qulaqlı eynəyini burnunun üzərinə salar və kağızları bərkdən hecalaya-hecalaya oxuyardı*. H.Nəzərli.

**QULAQLIQ** *is*. 1. İsti papağın qulağı örtən hissəsi, habelə şaxtadan qorunmaq üçün qulaqlara keçirilən isti qalpaq, yaxud qulaqları örtən örtü.

2. Radio dinləmək üçün qulaqlara keçirilən cihaz. *Hər nümayəndə oturduğu yerdə qulaqlıqlar vasitəsilə tribunadakı adamın nitqinə istədiyi dildə qulaq asa bilərdi*. M.İbrahimov.

**QULAQSIZ** *sif*. 1. Qulağı, yaxud qulaqları olmayan, qulaqları kəsilmiş. *Qulaqsız it*.

2. Qulağı, qulaqlığı olmayan. *Qulaqsız papaq*.

**QULAQUCU** *zərf* Ötəri, əhəmiyyət vermədən. *Hərdənbir qulaqucu oğlunun söhbətini eşidən Maral burada Züleyxanın dadına çatdı*. Ə.Əbülhəsən.

**QULAQYOLDAŞI** *is*. Həmsöhbət. *Nigar xanım dedi: – Gərək Telli xanımı Çənlibelə mənə qulaqyoldaşı gətirəsiniz*. "Koroğlu".

**QULAM** *is*. Qədim zamanlarda: qul, kölə, nökər, xidmətçi (oğlan). *Bir neçə dəqiqə keçəndən sonra qulamlar İlyası aralığa alıb gətirdilər*. M.S.Ordubadi. *Dumanlı bir gündə səhər ertə saray qulamlarından biri Kazımın həyatinə girib, artırmada hana toxuyan Telli ilə Gülnaza yanaşdı*. Çəmənzəminli.

**QULAN** b a x **qulun**. [İskəndər xan:] *Görəsən genə nə olubdur ki, kişi qulan kimi bağırır*.. N.Vəzirov. *Otlayıb doymuş bir qulan başını dik tutaraq, uzaqlara baxırdı*.. İ.Əfəndiyev.

**QULANCA** b a x **qulunca**.

**QULANCAR** *is. bot*. Bişirilib yeyilən zoğlu yabanı bitki. *Bacı və qardaş ətəklərinə yığdıqları qulancarı yerə töküb .. oturdular*. S.S.Axundov.

**QULAN-QUŞQUN** *is*. Qoşqu ləvazimatının hamısı.

◊ **Nə qulan-quşqun** – bir şeyin, bir hərəkətin daha möhtəməl, daha təbii olduğunu bildirir. *Molla Ağa Fazili Dərbəndi qıl körpüdən uçandan sonra, bizim tək günahkar bəndələrə nə qulan-quşqun*. Ə.Haqverdiyev.

**QULBEÇƏ** *is*. [*qul* və *fars*. beçə] *köhn*. 1. Kiçik qul.

2. Keçmişdə təvazö üçün özünə, yaxud öz uşaqlarına işarə olaraq deyilirdi. [Hacı Qara:] *Qalaya sifariş eləmişdim, qulbeçəniz bu malı təzə göndəribdir*. M.F.Axundzadə. [Ağa:] *..İldə beş-on şahı qulbeçələrimə çörək pulu aparıram*. Ə.Haqverdiyev.

**QULBİYABANI** b a x **qulyabanı**. *Və belə gülünc bir zamanda, belə qulbiyabanı bir insanların tarixini yazmaq üçün, əhval və ətvarını təsvir etmək üçün məgər Molla Nəsrəddinin yaranmağı təbii deyil?* C.Məmmədquluzadə.

**QULCUĞAZ** "Qul" söz. *oxş*. *Nola əgər gəhi sorasan halımı, çu mən; Bir qulcuğazınam sənin, ey padşahcığım*. Kişvəri.

**QULDAR** *is. tar.* Quldarlıq cəmiyyətində: qullara sahib olan adam.

**QULDARLIQ** *is. tar.* Qullara, kölələrə sahib olma, köləlik əsasında qurulma. *Quldarlıq cəmiyyəti. Quldarlıq quruluşu.*

**QULDUR** *is.* 1. Quldurluqla məşğul olan adam; çapqınçı, yolkəsən, soyğunçu. *Quldur dəstəsi. – Çar jandarmeriyası və çar polisləri Bakı şəhərini .. qarətçilərə, quldurlara, adam öldürənlərə tapşırmışdı.* M.S.Ordubadi. *Əbdülkərim indiki qaçaqlara bənzəməzdi. İndikilər quldurdurlar, yolkəsəndirlər, qaniçəndirlər..* Ə.Haqverdiyev. *..İndi ona yaxın düşməkmi olar? Özü güclü-zorlu, başında qoluzorba quldurlar.* M.Rzaquluzadə.

2. *məc.* Zülmkar, istismarçı mənasında. *Müstəmləkəçi quldurlar.*

**QULDURBAŞI** *is.* Quldur dəstəsinin başçısı, böyüyü, atamanı. *Amma .. mənim yadıma belə gəlir ki, keçən türk padşahları quldurbaşı kimi bir zad imişlər.* C.Məmmədquluzadə. [Həcər xanım:] *..Şahbaz bəyin arvadı quldurbaşı Əlimərdanın evində! Bu, yuxu deyil, nədir?* S.S.Axundov. *Quldurbaşı ziyafətin ən qızğın bir çağında içmək üçün qaldırdığı iri qədəhi var gücü ilə yerə çırpdı.* M.Rzaquluzadə.

**QULDURCASINA** *sif.* və *zərf* Quldur kimi, quldura xas olan bir tərzdə. *Quldurcasına basqın.*

**QULDURÇULUQ** b a x **quldurluq**.

**QULDUR-QAÇAQ** *top.* Quldurlar, qaçaqlar. [Gülpəri:] *Yəqin fəqir quldur-qaçaq əlinə keçdi..* Ə.Haqverdiyev.

**QULDURLUQ** *is.* Soyğunçuluq, yaxud öldürmək məqsədi ilə silahlı basqın; çapovulçuluq, yol kəsmə. *Heydər bəy, rahat dur-otur, quldurluq etmə, yol kəsmə, oğurluğa getmə!* M.F.Axundzadə. [Soltan:] *Balam, mən saqqalımın bu ağ vaxtında necə sizə izin verim ki, gedib quldurluq edəsiniz?* C.Məmmədquluzadə. [Gülpəri:] *..Əmiraslan məni qovub, özü də qaçaq dəstəsinə qoşuldu. Bir neçə müddət quldurluq edəndən sonra divan tərəfindən tutulub asıldı.* S.S.Axundov.

**QULİ-BİYABAN** [*ər.* ğul (b a x **qul**[2]) və *fars.* biyaban] b a x **qulyabanı**. *Bilsə idi sənə Yusif deyəcəklər, billah; Qoyar idi adını quli-biyaban, Yusif!* S.Ə.Şirvani. *Seyr edirəm bərrü biyabanları; Quli-biyaban görürəm, qorxmuram.* M.Ə.Sabir.

**QULĞULA** b a x **qülğülə**.

**QUL-QARAVAŞ** *top.* Nökərlər, xidmətçilər. [Hacı Murad:] *..Yanında qul-qaravaş ilə qonaqlığa gedəndə, cəmi arvadlar ona həsrət aparacaqlar.* S.S.Axundov.

**QULLAB** *is.* 1. Bir udum hava çəkmə; bir çəkim, tüstünü bir nəfəs içəri çəkmə miqdarı. ◻ **Qullab vurmaq (almaq)** – papirosun, qəlyanın tüstüsünü hər dəfə içinə çəkmək. *Mən əlimdəki papirosa bir qullab vuraraq, bir az düşündüm.* M.S.Ordubadi. *Miraxur özünü toxtatmaq üçün çubuğa bir qullab vurdu, üfüqə toplanan qara buludlara baxdı, köksünü ötürdü.* Çəmənzəminli. *Vəli qəzet kağızından nazik, uzun bir papiros bükdü və yandırıb üç-dörd qullab vurdu.* M.Hüseyn.

2. *köhn.* Çəngəl, qarmaq. *Yadıma düşəndə zülfün ənbəri; Qullab girər ciyərimdən içəri.* M.P.Vaqif.

**QULLABI** *is.* [*ər.*] Yalan, saxta, hiylə, fırıldaq; əngəl. *Bu isə, bəs o ləinin də işi qullabıdır.* M.Ə.Sabir.

**QULLABLAMA** "Qullablamaq"dan *f.is.*

**QULLABLAMAQ** *f.* Qullab vurmaq (b a x **qullab** 1-ci mənada). *Bir ara onlar susub ovucları içində saxladıqları papiroslarını qullabladılar.* Ə.Əbülhəsən. *Mədəd başıaçıq otaqda gəzinir, papirosu tez-tez qullablayır.* Ə.Vəliyev.

**QULLUQ**[1] *is.* 1. Xidmət, iş, vəzifə. *O, böyük qulluqdadır. – Qulam mətbəədə qulluğa düzəldi.* Mir Cəlal. // İş yeri, iş. [Turab] *qulluğa yorğun getdi. Qızarmış gözlərinin altı kölgəli idi. Tez-tez əsnəyirdi.* M.Hüseyn. ◻ **Qulluq etmək** – 1) xidmət etmək, bir idarədə və ya başqa yerdə işləmək, rəsmi vəzifədə olmaq. *Bir azdan sonra Fərhad mühəndis vəzifəsində qulluğa girdi.* C.Cabbarlı. *Cavan vaxtlarımda mən İrəvanda naçalnik divanxanasında qulluq edirdim. Qulluğumun adı dilmanclıq idi.* C.Məmmədquluzadə; 2) hərbi mükəlləfiyyəti yerinə yetirmək. *Orduda qulluq etmək. Hərbi donanmada, aviasiyada qulluq etmək.* **Qulluğa durmaq (girmək)** – 1) xidmətə girmək, işə girmək.

*Orada öz əhvalatını* [Haşım] *Hacı Məhəmmədə söyləyib, onun yanında qulluğa durdu.* B.Talıblı; 2) baxmaq, xidmət etmək, qeydinə qalaraq kömək etmək. *Xəstəyə qulluq etmək. Yaralıya qulluq etmək. O, qoca anasına yaxşı qulluq edir.* – ..[Qaraca qızın yanında] *yalnız Yasəmənin dostu Hüsniyə qalar, ona qulluq edər.* S.S.Axundov. *İskəndər səbir edib, yarım ilə qədər gözlədi. Canına qulluq eləyib əkinə-biçinə getdi.* M.Hüseyn; // becərmək, baxmaq. *Ağaclara qulluq etmək. Bağa yaxşı qulluq etmək*; 3) *məc.* Bir şeyin xeyrinə, mənfəətinə işləmək, bir məqsədə xidmət etmək, uğrunda çalışmaq. *Xalqa qulluq etmək. Vətənə qulluq etmək. İncəsənətə qulluq etmək. Elmə qulluq etmək.* **Qulluğunda durmaq (olmaq)** – xidmət etməyə hazır olmaq, əmrinə hazır olmaq. *Dəli Həsən onun qılıncının altından keçdi, ölənəcən ona qardaş olub, qulluğunda durmağa and içdi.* "Koroğlu".

2. Buyuruq, əmr, tapşırıq; xahiş, iş. *Mənə aid qulluğunuz?* – [Məstan bəy:] *Qulluğunuz nədir? – deyə* [Nadirdən] *sordu. O, cavab verdi: – Bir qulluğum yoxdur.* B.Talıblı. *Buyurun, nə qulluğunuz var? – sizdən xahişim budur ki, gözünüz bu uşağın üstündə olsun.* Mir Cəlal.

3. *köhn.* Hüzur. ☐ **Qulluğuna gətirmək (çağırmaq)** *köhn.* – böyük bir adamın qabağına, hüzuruna, yanına gətirtmək (çağırtmaq). [Nadir şah] *..vilayətin böyük adamlarını, dövlət ərkanını və məmləkətin əyanlarını öz qulluğuna çağırdı.* "Qarabağnamə". [Dilmanc:] *Qoy ərzin qalsın sonraya və bu saat get, oğlun Süleymanı gətir naçalnikin qulluğuna.* C.Məmmədquluzadə.

**QULLUQ²** *is. köhn.* Qul olmuş adamın halı; köləlik.

**QULLUQBAZ** *sif.* və *is.* [qulluq və *fars.* ...baz] Qulluğu vaxtında yerinə yetirən, qulluq etməyi sevən, yaxud vəzifə ilə əlaqədar olan rəsmiyyətlərə həddindən artıq riayət edən. *Manqa üzvləri* [Xanpərinin] *bu qədər qulluqbaz olduğuna təəccüb edirdilər.* Ə.Vəliyev.

**QULLUQBAZLIQ** *is.* Öz qulluğunu sevmə, vəzifəsi ilə əlaqədar olan rəsmiyyətlərə həddindən artıq riayət etmə.

**QULLUQÇU** *is.* 1. Zehni əməyin müxtəlif sahələrində muzd ilə işləyən işçi; idarə xidmətçisi. *Keçmiş vaxtlarda dəftərxanalarda qulluqçuların gündə biri idarə bağlanandan sonra qalıb təcili teleqramları qəbul edərdi.* Ə.Haqverdiyev. *Dəftərxana qulluqçuları .. onun dediyi adamları soraqlaşırdılar.* Ə.Əbülhəsən.

2. Ev xidmətçisi (qız, qadın). *İnciyib axırda o qulluqçular; Ol xoruzu öldürübən atdılar.* A.Səhhət. *Bu vaxt qapıdan qulluqçu, Sonanı atasının yanına çağırdı.* N.Nərimanov. // Ümumiyyətlə, xidmətçi. *Qulluqçular bağçanı silib süpürər, yığışdırardı.* Mir Cəlal.

3. *köhn.* Balaca əl lampası, ya çıraq. *Qulluqçunu götür, bir mal-qaranı yoxla.*

**QULLUQÇULUQ** *is.* Maaşla bir idarədə və ya bir yerdə xidmət etmə, işləmə; xidmətçilik; qulluqçunun işi, peşəsi. [Tafta:] *Buradan gedəndən sonra* [Sevil] *Səmədgildə qulluqçuluq edirdi.* C.Cabbarlı. *Ehtiyac üzündən özgə qapısında qulluqçuluq edən qız, görmədiyi, sevmədiyi dəli bir dövlətliyə satılır.* S.S.Axundov.

**QULP** *is.* Qabların və s. şeylərin əl tutan yeri, dəstəsi, sapı. *Qazanın qulpu. Çaydanın qulpu.* – [Musa kişi] *nazik iplə kuzənin qulpuna bağlanmış tıxacı açdı.* M.İbrahimov. *Onun sağ əli su ilə dolu vedrənin qulpundan .. tutmuşdu.* Ə.Əbülhəsən.

◊ **Qulp bağlamaq (qoymaq, qondarmaq, taxmaq)** – irad çıxartmaq, bəhanə tapmaq. [Uşaq:] *..Hətta yeyib-içməyimə bir qulp taxır, söylənir, bağırır.* A.Şaiq. *O hər şeyə etiraz edir, hər sözə qulp qoyur, min cür şıltaqlıq göstərirdi.* Ə.Vəliyev. **Qulpunu itirmək** – haradan tutacağını bilməmək, hesabını çaşdırmaq. **İşin qulpundan yapışmaq** – bir işə girişmək, bir işdən yapışmaq, bir işlə məşğul olmağa başlamaq. *Uşaqlar böyüyüb hərəsi bir işin qulpundan yapışandan sonra, Əkbər tamam rahat nəfəs alacaqdı.* Mir Cəlal. **Yumurtaya qulp taxmaq** – hər şeyə bir bəhanə və səbəb tapmaq.

**QULPLAMA** "Qulplamaq"dan *f.is.*

**QULPLAMAQ** *f.* Qulp taxmaq, bir qaba və s.-yə qulp və ya sap keçirmək.

**QULPLATMA** "Qulplatmaq"dan *f.is.*

**QULPLATMAQ** *icb.* Qulp taxdırmaq.

**QULPLU** *sif.* Qulpu, tutacaq yeri olan. *Qulplu qab. Qulplu şamdan. – Qulplu qazanlar həyətdə yan-yana söykənmişdi.* Ə.Haqverdiyev. *Yolçəkən hər bir dəstə üçün ayrıca olaraq iri qulplu qazanlarda isti xörəklər hazırlanırdı.* S.Rəhimov.

**QULUN** *is.* Körpə at balası. *..Göydə bir madyan gördüm; Yerdə qulun əmər hey.* (Bayatı). *Daylar tülədi, buraxdı yalı; Kişnər çalağan qulun misalı.* Xətayi.

**QULUNC** *is.* [*ər.* əsli *yun.*] Soyuqdəymə nəticəsində əksərən kürək əzələlərində əmələ gələn ağrı. [Sübhanverdizadəyə] *elə gəldi ki, onun quluncu bərk sancır, kürəyi qovuşur, ürəyi qalxır, dizləri qopur, beli sınır.* S.Rəhimov. ☐ **Qulunc olmaq** – soyuq dəymək nəticəsində kürək əzələlərində ağrı əmələ gəlmək. *Bəli, səs düşür ki, şeyx cənablarına soyuq dəyib və qulunc olub.* C.Məmmədquluzadə. **Quluncunu sındırmaq (ovmaq, tutmaq)** – ağrını sakit etmək üçün kürək əzələlərini tutub ovmaq, sıxmaq. [Allahqulu:] *..Deyir ayağımı ov, ovuram, deyir quluncumu sındır, quluncunu sındırıram, bundan nə çıxar?* N.Vəzirov.

**QULUNCA** *is.* Yeni doğulmuş at balası.

**QULUNCAN** *is. bot.* Xalq təbabətində işlədilən, darçına oxşar bir bitki kökü. *Allahqulu quluncan çayını başına çəkib, yanıqlı bir halda piyaləni Telliyə uzatdı.* Çəmənzəminli. *Sövdaya, bel ağrısına, badi-fitnə, sancıya; Zəncəfilü hil, mixək, darçın, quluncan yaxşıdır.* M.Möcüz.

**QULUNLAMA** "Qulunlamaq"dan *f.is.*

**QULUNLAMAQ** *f.* Bala doğmaq (madyan haqqında). *Madyanlar qulunlamışdır.*

**QULUNLU** *sif.* Yanında balası olan, qulunu olan. *Satış üçün bazara gətirilən qoyunlar, keçilər, yanı buzovlu inəklər, qulunlu madyanlar, uzunqulaqlar bazarın kənarındakı təpəyə yığılmışdı.* S.Rəhimov.

**QULYABANI** *is.* 1. Xurafatçıların təsəvvürüncə guya tənha çöllərdə, qalın meşələrdə tək qaldıqda adamın gözünə görünən mövhum bir vücud. *Əsəd başını yelləyib xortdanın uzun olduğunu təsdiq etdi: – Gördünüzmü, süpürgəsaqqal deyil, qulyabanıdır.* B.Talıblı.

2. *dan.* Çox çirkin, bədheybət, qorxunc görünüşlü adam haqqında. *O lap qulyabanıya oxşayır.*

**QUM** *is.* Bərk mineralların, əksərən kvarsın narın dənələri. *Dəniz qumu. İri qum. – ..Səki çay qumundan ibarət olduğu üçün palçıqsız və təmiz idi.* M.İbrahimov. *Mühəndis təpənin üstünə çıxıb qumu bir xeyli kürəklədi.* Mir Cəlal. ☐ **Qum saatı** – iki hissədən ibarət və qumun keçməsi üçün aralarında dar deşik olan hər iki başı qapalı qovuşuq şüşə boru şəklində cihaz (bu borunun bir tərəfindəki narın qum müəyyən vaxt ərzində o biri tərəfinə tökülməklə istənilən vaxtı göstərir).

**QUMAR** *is.* [*ər.*] Pul və s. ilə oynanılan oyun. [Səlim bəy:] *Həmişə qış uzunu bikar qalanda oğlunla lopuqdan qumar oynayırdın.* Ə.Haqverdiyev. *Bir cavanın mən dünən gördüm cibində yüz tümən; İndi bir dinarı yox, bais qumar olsun gərək.* M.Möcüz. [Surxay:] *O, pullarını qumara uduzub, ac qalıb, mən isə qumar oynamadan ac qalmışam.* S.Rəhman.

**QUMARBAZ** *is.* [*ər.* qimar və *fars.* ...baz] Qumar oynamağı özünə adət etmiş adam. [Həpo:] *Qumarbaz baba idim, aldım, apardım, çünki nahaq işdən ötrü verilmişdi, bərəkəti də olmadı.* M.F.Axundzadə. *Qumarbazlar arasında ürəkli aşıq atan kim idi? – Başmaqçı oğlu Şaban.* Ə.Haqverdiyev. [Surxay:] *Səninlə qumarbaz Nəcəf bəyin arasında yer ilə göy qədər fərq var.* S.Rəhman.

**QUMARBAZLIQ** *is.* Qumarbazın işi, peşəsi; qumar oynamağı özünə peşə etmiş adamın hal və keyfiyyəti.

**QUMARÇI** b a x **qumarbaz**.

**QUMARÇILIQ** b a x **qumarbazlıq**.

**QUMARXANA** *is.* [*ər.* qimar və *fars.* ...xanə] Qumar oynanılan yer. [Həcər xanım:] *Şahbaz bəy evimi .. qumarxanaya döndərib.* S.S.Axundov. *Çayçı dükanının dal tərəfində qumarxana olardı.* H.Sarabski.

**QUMAŞ** *is.* [*ər.*] İpək, yun, kətan və s.-dən toxunmuş parça; ümumiyyətlə parça, arşınmalı. [Hacı Qara:] *Bunların qumaşı özgə qumaşdır, müştəri macal vermir.* M.F.Axundzadə. *Al qumaşa bəzənərək yurdumuzun qızları; Bir şairin könlü kimi qarşılayır baharı.* S.Vurğun. // Məc. mənada. *Qumaş paltarını geymişdi dağlar; Töküldü sinəmə şır-şır bulaqlar.* O.Sarıvəlli.

**QUMBARA** *is.* 1. Bomba, top gülləsi. *Əl qumbarası* (*əl bombası*). – *Yaxında partlayan qumbaradan qıçı və qolu yaralanmış Əhməddən əvvəl Səlim döyüş meydanından götürülmüşdü.* Ə.Əbülhəsən.

2. İdman məşğələlərində: uzağa və ya hədəfə atmaq üçün mərmi və s. *Spartakiadanın proqramına qumbara tullamaq da daxil idi.*

**QUMBARAATAN** *is.* və *sif.* 1. Müharibədə düşmən üzərinə qumbara atan top, ya əsgər.

2. *idm.* Qumbara atmaqda mütəxəssis olan idmançı.

**QUMBARAÇI** 1. *köhn.* b a x **qumbaraatan** 1-ci mənada.

2. *is.* Qumbara qayıran usta.

**QUMBRİ́N** [əsli *lat.*] Neft tullantılarından hazırlanan süni gübrə.

**QUMBRİNLİ** *sif.* Tərkibində qumbrin olan.

**QUMDARISI** *is. məh. bot.* Taxıl fəsiləsindən yem bitkisi.

**QUMDAŞI** *is. geol.* Gil, əhəng və s. ilə qarışıb bərkimiş qumdan ibarət süxur. *Çökmə süxurların dənizdə əmələ gələn növlərinə misal olaraq qumdaşı, əhəngdaşı, gil və s. göstərmək olar.* M.Qaşqay.

**QUMEŞƏN** *is. zool.* Balıq kürüsündən çıxan sürfə.

**QUM-QUM** *zərf dan.* Çəngə-çəngə, kom-kom, topa-topa. *Bəşirin bu cavabı biçarənin canına lərzə salır, uca səslə fəryad edib və saçlarını qum-qum dibindən qoparır.* F.Köçərli.

**QUMQUMA** *is.* [*ər.*] 1. Yandan asılan kiçik su qabı. *Bir çoxları öz yol xərcliyini, .. qumqumasını alıb yola düşməyə hazırlanır.* M.S.Ordubadi.

2. *məh. zool.* İlk baharda bağlarda və meşələrdə meyvə ağaclarına daraşıb, onların yarpaqlarını yeyən və ağzından buraxdığı tora oxşar maddə ilə onları bürüşdürən ziyanverici tırtıl. *İndi bağları qumqumadan təmizləmək üçün ağacları təyyarə ilə havadan dərmanlayırlar.*

**QUMQUMAÇI** *is. dan.* Həddən artıq xırdaçı, vasvası, zəhlətökən adam.

**QUMLAQ** b a x **qumluq** 2-ci mənada.

**QUMLAMA** "Qumlamaq"dan *f.is.*

**QUMLAMAQ** *f.* 1. Qumla sürtüb yumaq, təmizləmək; qumla silmək, sürtmək. *Qabları qumlayıb təmizləmək.*

2. Bir şeyin üstünü qumla örtmək, bir şeyi qum altında basdırmaq.

**QUMLANMA** "Qumlanmaq"dan *f.is.*

**QUMLANMAQ** *məch.* 1. Qumla sürtülüb təmizlənmək, qumla silinmək.

2. Üstü qumla örtülmək, qum altında basdırılmaq.

**QUMLU** *sif.* 1. İçində, tərkibində qum olan, qum qarışığı olan. *Qumlu kirəc. Qumlu sement. Qumlu suvaq.*

2. Qumu çox olan, qumla örtülü olan. *Qumlu sahil. Qumlu səhra.* – *Kəndin bütün ətrafını aradım; ancaq burada bir parça qumlu yer tapdım, soyunub uzandım; günəş vannası alırdım, – deyə doktor izahat verdi.* B.Talıblı.

**QUMLUCA** *is.* 1. *bot.* Birillik, ya çoxillik bəzək bitkisi.

2. Çoxlu miqdarda qum qatışığı olan yumşaq torpaq.

**QUMLUQ** 1. *sif.* Qumdan ibarət olan, qumla örtülü olan, qumsal. *Qumluq yer. Qumluq səhra. Qumluq təpə.*

2. *is.* Qumsal yer, qumu çox olan, qumla örtülü yer. *Bu qumluqda ağac bitməz.* – *Qumluqlara lalə, nərgiz əkirsiz; Siz dolanıb yağa-yağa buludlar!* H.K.Sanılı. *Bir az aralıda, sakit gölün başında dayanan Əlyar, qarmağı sallayır və çox gözlədikdən sonra .. balaca sucuq balıqları qarmaqdan çıxarır, qumluğa atırdı.* S.Rəhimov.

**QUMLULUQ** *is.* Qumlu şeyin halı; tərkibində, içində qum olma. *Süxurun qumluluğu.*

**QUMRAL** *sif.* Açıq-şabalıdı rəngində olan. *Ayrım qızı qısaboylu, kök bir qadın idi. Kiçik qumral gözləri, ay kimi yuvarlaq üzü var idi.* A.Şaiq. *O qumral saçları tökəndə üzə; Olur könlüm evi viranə, dilbər.* R.Rza. *Elmü ürfan qazanmağa getdiyi yerdə; Əsir oldu, aşiq oldu bir qumral qıza.* Ə.Cavad.

**QUMRALLIQ** *is.* Qumral rəngində olma, qumral rəngində olan şeyin halı.

**QUMRALSAÇLI** *sif.* Saçı qumral (açıq-şabalıdı) rəngində olan. *Məmməd bəy on iki-on üç yaşında alagözlü, qumralsaçlı .. bir oğlan idi.* Çəmənzəminli.

**QUMRO(V)** *is.* Girdə zəng; zınqırov. *Tulaları çağırmağa ehtiyac yox idi, çünki qızılquşun qumro səsi onları xəbərdar etmiş idi.* S.S.Axundov. *Birdən miyandarın səsi eşidildi, qumrov cingildədi. O saat musiqi başlandı.* Çəmənzəminli.

**QUMROVLU** *sif.* Boynundan və s.-dən qumrov asılmış, zınqırovlu. *Bir günün içərisində otuz başdan yuxarı .. boğazı qumrovlu əmlik toplandı.* S.Rəhimov.

**QUMRU** *is. zool.* Göyərçin cinsindən boz rəngli gözəl bir quş. *Bülbüllərə şərh edərdi halın; Qumrulara möhnətü məlalın.* Füzuli. *Yenə yaşıl don geyinmiş çəmənlər gülür; Təbiətdən ilham alıb ötür qumrular.* S.Vurğun. *Gündüzümün, gecəmin fəraqını yığaraq; Qəfəsdə qumru kimi səni gözləyəndə, bax.* R.Rza.

**QUMSAL** 1. *is.* Qumluq yer, qumla örtülü olan dəniz sahili. [Şeyda:] *Bir də bilirsən ki, bizim torpaqlar susuz, ələfsiz Ərəbistan qumsalıdır.* A.Şaiq. *Haqqı var vüqarla dərə gəzdirə; Səni bu qumsalda bitirən əllər.* O.Sarıvəlli. *Qumsalları öpür ləpə; Ağ incilər səpə-səpə.* M.Dilbazi.

2. *sif.* Qumla qarışıq olan. *Ağır gilli torpaqlarda toxumu 3-4, yüngül qumsal torpaqlarda isə 4-5 sm dərinliyə səpmək lazımdır.*

**QUMSALLI** b a x **qumsal**. *O daşlı, qumsallı, gilli torpağı; Udur, lay-lay udur ekskavatorlar.* S.Vurğun.

**QUMSALLIQ** *is.* Qumsal yer, qumluq. *Başımız üzərində bütün qüvvəti ilə hərarət saçmaqda olan günəş qumsallığı qor halına gətirmişdi.* A.Şaiq. *Hacıqabuldan sonra .. qumsallıq başlayır.* Ə.Əbülhəsən.

**QUMSOVURAN** *sif.* və *is. xüs.* Tikinti işləri aparılan yerdə qumu, torpağı sovuran (maşın). *Qumsovuran maşın.*

**QUMUQ** *is.* Dağıstanda yaşayan türkdilli xalq və bu xalqa mənsub adam. *Qumuq dili. Qumuq xalqı.*

**QUMUQCA** *sif.* və *zərf* Qumuq dilində. *Qumuqca kitab. Qumuqca danışmaq.*

**QUNC** *is.* 1. Corabın, uzunboğaz çəkmənin və s. ayaqqabıların dizə qədər qalxan hissəsi. [Məstan bəy] *çəkməsinin qtuncundan qamçısını çıxarıb, əlində fırlatmağa başladı.* B.Talıblı.

2. Bir şeyin tutacaq yeri. ..*Sənəm atası ilə birlikdə çuvalların quncundan yapışıb .. arabaya yığdı.* Ə.Əbülhəsən.

**QUNCLU** *sif.* Quncu olan. *Qunclu çəkmə. Qunclu corab.*

**QUNCSUZ** *sif.* Quncu olmayan. *Quncsuz ayaqqabı. Quncsuz corab.*

**QUNDAQ**[1] *is.* 1. Körpə uşaqları sarımaq üçün sarğı ləvazimatı.

2. Yerlik halında: **qundaqda** – b a x **qundaqlı**[1]. [Ağa Mərdan:] *O vaxtda onun yanında qundaqda bir aylıq tifil oğlunu gördünüzmü?* M.F.Axundzadə.

3. *məh.* Körpə uşaq mənasında.

**QUNDAQ**[2] *is.* Tüfəngin ağac hissəsi. *Araz tüfəngin qundağı ilə onu elə vurdu ki, o geri-geri çəkilərək yerə sərildi.* A.Şaiq. *Qapı tüfəng qundağının zərbəsindən titrədi.* M.İbrahimov.

**QUNDAQBAĞI** *is.* Qundağı (1-ci mənada) sarımağa məxsus bağ.

**QUNDAQÇI** *is.* b a x **qundaqsaz**.

**QUNDAQLAMA**[1] "Qundaqlamaq[1]"dan *f.is.*

**QUNDAQLAMA**[2] "Qundaqlamaq[2]"dan *f.is.*

**QUNDAQLAMAQ**[1] *f.* Uşağı qundağa sarımaq, bələmək. *Uşağı yuyundurub qundaqlamaq. – Adını Leyla qoyub, qızı qundaqladılar.* S.Rüstəm. // *məc.* Bir şeyi sarıyıb bürümək, boğça halına salmaq. *Paltarları qundaqlayıb qoltuğuna aldı.*

**QUNDAQLAMAQ**[2] *f.* Tüfəngə qundaq bağlamaq, qundaq salmaq.

**QUNDAQLANMA**[1] "Qundaqlanmaq[1]"dan *f.is.*

**QUNDAQLANMA**[2] "Qundaqlanmaq[2]"dan *f.is.*

**QUNDAQLANMAQ**[1] *məch.* Qundaqla sarınmaq, bələnmək (uşaq haqqında). // *məc.* Sarınmaq, boğça halında bağlanmaq.

**QUNDAQLANMAQ**[2] *məch.* Qundaq salınmaq (tüfəngə).

**QUNDAQLATMA**[1] "Qundaqlatmaq[1]"dan *f.is.*

**QUNDAQLATMA**[2] "Qundaqlatmaq[2]"dan *f.is.*

**QUNDAQLATMAQ**[1] *icb.* Uşağı qundağa sarıtmaq, bələtmək.

**QUNDAQLATMAQ**[2] *icb.* Tüfəngə qundaq bağlatmaq.

**QUNDAQLI**[1] *sif.* Qundağa sarılmış, qundaqda olan. *Qundaqlı uşaq.* // Sarınmış, sarıqlı.

**QUNDAQLI**[2] *sif.* Qundağı olan. *Qundaqlı tüfəng. – Yasavul uzun qırmızı təpəli sarı papağını kənardakı qara qundaqlı berdankasının başına keçirtmiş*(*di*). S.Rəhimov.

**QUNDAQLIQ** *sif.* Qundağa yararlı. *Qundaqlıq bez.*

**QUNDAQSAZ** *is.* [qundaq və *fars*. ...saz] 1. *köhn.* Araba qayıran, araba təmir edən usta. *Bakıda ümumiyyətlə peşəkarlar: bənna, xarrat, dəmirçi, .. qundaqsaz və sairə çox olardı.* H.Sarabski.

2. *məh*. Keçmişdə tüfəng qundağı qayıran, tüfəng təmir edən usta.

**QUNDAQSIZ**[1] *sif.* Qundağa sarınmamış, bələnməmiş.

**QUNDAQSIZ**[2] *sif.* Qundağı olmayan (tüfəng və s.).

**QUNDUŞ** *is. bot*. Zəhərli yabanı ot bitki.

**QUNDUZ** *is. zool*. Qiymətli dərisi (xəzi) olan gəmirici heyvan*. Qunduz xəzi. – Gəmiricilər içərisində ən gözəl xəzi olan qunduzdur. Qunduzların xəzi şabalıdı qonur rəngdə olur və qıl tüklərin altında dərini islanmağa qoymayan sıx yumşaq tükləri olur*. "Zoologiya".

**QUPQURU** *sif.* Tamamilə quru, lap quru, quruyub bərkimiş. *Qupquru ot. Qupquru yer. Qupquru çörək. – Zənn eyləməsin könlümün eşq atəşi söndü; Yaxud ürəyim qupquru bir yarpağa döndü*. S.Rüstəm. // Zərf mənasında. [Xəstənin] *dodaqları qupquru qurumuşdu*. Mir Cəlal.

**QURABİYƏ** *is.* [*ər.*] Un, şəkər, süd, badam və s.-dən hazırlanan girdə, yaxud uzunsov və ya başqa şəkillərdə kiçik kövrək qoğal. *Məşədi İmaməli çay gətirdi; yaxşı İran qurabiyəsi gətirdi, yaxşı püstə, badam gətirdi, qoydu qabağımıza.* C.Məmmədquluzadə. *Qələmkar süfrənin üstündə laciverdi saxsı qablarda noğul, paxlava, şəkərçörəyi, qurabiyə qoyulmuşdu.* Çəmənzəminli.

**QURAQ**[1] *sif.* və *zərf* Yağmursuz, quru, rütubətsiz. *Quraq il. Bu il yaz quraq keçdi. – Bəzən də ruzigar dəyişir, hava elə quraq keçir ki, cücü əlindən yollardan ötmək olmur*. Mir Cəlal.

**QURAQ**[2] *is.* Paltarın və s.-nin bir yerinə artırılmış parça və s.

**QURAQLI** *sif.* Qurağı olan (b a x **quraq**[2]).

**QURAQLIĞADAVAMLI** *sif.* Quraqlıqdan qorxmayan, çox rütubət, su tələb etməyən. *Quraqlığadavamlı bitkilər.*

**QURAQLIQ** *is.* Havaların isti keçməsi ilə bərabər, uzun müddət yağış yağmaması üzündən torpaqda rütubətin çatmaması və bunun nəticəsində əkin və bitkilərin tamamilə, ya qismən quruyub tələf olması. *Keçən il nəhayətdə quraqlıq olmaq səbəbi ilə və Qəzvinin ətrafında suyun qıtlığı cəhəti ilə əksəri-məhsulat yanıb əmələ gəlməmişdi.* M.F.Axundzadə. *Məlumdur ki, bu il çox yerlərdə quraqlıq keçir və əkinlər susuzluqdan yanıb puça çıxırlar.* C.Məmmədquluzadə.

**QURAQSIMA** "Quraqsımaq"dan *f.is.*

**QURAQSIMAQ** *f.* 1. Qurumaq, quraqlıq əmələ gəlmək. *Xanpərinin sahəsi selləmə sulandığı üçün isti günlərdə dərhal quraqsıyırdı*. Ə.Vəliyev.

2. *məc.* Bir şeyin həsrətində olmaq.

**QURALTMAQ** *f.* Quraşdırmaq, uydurmaq. [Şəhrəbanı xanım:] *Allahı sevirsən, öz yanından zad quraltma, indi bildim ki, doğrudan da ağlayırmışsan*. M.F.Axundzadə.

**QURAMA**[1] *sif.* Xırda-xırda və rəngbərəng parçalardan calanıb tikilmiş, yaxud düzəldilmiş. *Qurama yorğanüzü. Qurama qapı. – Qaravaşlardan biri dizi üstə durub, qurama boğçanın bir ucundan tutub nə isə xanıma göstərirdi.* Çəmənzəminli.

**QURAMA**[2] *is.* Özündən quraşdırılmış söz və s.; uydurma. *Yusif Qəhrəmanın bu vəziyyətə düşməsindən istifadə edərək, daha bir çox quramalar və əlavələr etməyə cəhd edirdi*. Ə.Vəliyev.

**QURAMAÇI** *is.* Kəsik parçalardan qurama hazırlayan, düzəldən usta.

**QURAMAÇILIQ** *is.* Quramaçı sənəti.

**QURAMAQ** *f.* Bütöv bir şeydən deyil, parçalardan quraşdırmaq, qondarmaq, onları bir-birinə calamaqla düzəltmək, hazırlamaq. *Yorğanüzü quramaq. Qapı taxtası quramaq*.

**QURAMALIQ** *sif. dan*. Qurama üçün yararlı. *Quramalıq parça. Quramalıq taxta*.

**QURAN**[1] *f.sif.* Qurmaqla, quruculuqla məşğul olan; yaradıcı, qurucu. *Hər bir namuslu yazıçı öz əsərləri ilə quran və yaradan həmvətənlərini ruhlandırmalıdır.*

**QURAN²** *is.* Müsəlmanların müqəddəs dini kitabı. *Nə bilir oxumayan müshəfi-hüsnün şərhin; Yerə gögdən nə üçün endigini Quranın.* Füzuli.

☐ **Quran-kərim** – səmavi kitablar arasında ən son və ən böyük kitab. Lüğəvi mənası alicənab, səxavətli, mərhəmətli, müqəddəs Allah kitabı. **Quran ayəsi** *məc.* – ehkam kimi qəbul edilən fikir, söz. *Yaltaqlar hökmdarın ağzından çıxan hər bir adi sözü Quran ayəsi kimi .. təbir edərək, onun özünə satırlar.* M.S.Ordubadi.

**QURAŞDIRICI** *is. xüs.* 1. Quraşdırma mütəxəssisi. *İnşaatçılar divarlara beton salır, quraşdırıcılar karkasları qururdular.* – [Yunus] *salam verib, quraşdırıcılarla görüşdü.* Mir Cəlal.

2. *sif.* Quraşdıran, quraşdırma işi ilə məşğul olan. *Quraşdırıcı işçi komanda verir və ağır tava divarların üstünə qoyulur.*

**QURAŞDIRILMA** "Quraşdırılmaq"dan *f.is.*

**QURAŞDIRILMAQ** *məch.* 1. Müxtəlif parçalardan calanaraq düzəldilmək, qayrılmaq.

2. Yığılıb qurulmaq, birləşdirilmək, hissələri yerbəyer yerləşdirilmək. *Maşınlar quraşdırılmışdır.*

3. *məc.* Özündən uydurulmaq, düzəldilmək.

**QURAŞDIRILMIŞ** *f.sif.* 1. Quraşdırılmaqla düzəldilmiş, qayrılmış. *Quraşdırılmış maşın.* – *Qapını bu evlərdə taxtadan, ya da dəmirdən quraşdırılmış eybəcər qapaqlar əvəz edirdi.* Ə.Əbülhəsən.

2. *məc.* Uydurulmuş.

**QURAŞDIRMA** 1. "Quraşdırmaq"dan *f.is.* *İnşaat və quraşdırma işlərini xeyli sürətləndirməyə imkan yarandı.*

2. *sif.* Quraşdırılan, quraşdırılmış, bir-birinə quraşdırılan.

3. *is. məc.* Əsli olmayan söz, xəbər və s.; yalan, uydurma.

**QURAŞDIRMAQ** *f.* 1. Bir neçə müxtəlif parçanı bir-birinə calamaq, bitişdirmək, uyuşdurmaq. // Qatmaq, birləşdirmək, calamaq, yapışdırmaq. [Səfər bəy Axunda:] *..Bulaq yanında olanların bir parça yeri var, onu gərək bulaqqarışıq şəriətin yolu ilə mənim yerimə quraşdırasan.* B.Talıblı.

2. *xüs.* Maşının və s.-nin hissələrini yığıb qurmaq, birləşdirmək, yerbəyer yerləşdirmək. *Özüllər qurulduqdan sonra vışka quraşdırılır.* Quliyev.

3. *məc.* Özündən düzəltmək, özündən toxumaq, uydurmaq. *..Zeynalın özündən quraşdırıb oxuduğu şikəstə ortalığı daha da canlandırdı.* Ə.Əbülhəsən.

**QURAŞIQ** *sif.* Bir-birinə quraşdırılmış.

**QURAŞMAQ** *f.* Yaraşmaq, uyuşmaq, bir-birinə münasib olmaq.

**QURBAĞA** *is.* 1. Sıçramaq üçün dal ayaqları uzun, suda və quruda yaşayan quyruqsuz heyvan. ☐ **Qara qurbağa** – qurbağanın çöldə (quruda) yaşayan növü. **Ağac qurbağası** – qurbağanın ağacda yaşayan növü; yaşıl qurbağa. **Quyruqlu qurbağa** – qurbağa balası, çömçəquyruq.

2. Qapının bir tayını bərkidib saxlamaq üçün dil şəklində cəftə.

◊ **Qurbağa(nın) gölünə daş atdı(lar) (daş atıldı)** – birdən-birə sükut düşmək, hamı susmaq, səslər kəsilmək mənasında. *Qlavalar çıxdılar qapıya, xanım çıxdı balkona, tulalar hücum çəkdilər adamların üstünə və bir qədər keçdi, guya qurbağanın gölünə daş atdılar, çünki bu gələn naçalnik deyilmiş, özgə mahalın pristavı imiş.* C.Məmmədquluzadə. *Elə bil qurbağanın gölünə daş atıldı, Tapdıq səsini kəsdi.* Ə.Vəliyev.

**QURBAĞACIQ** *is.* Kiçik qurbağa, qurbağa balası.

**QURBAĞAGÖZ** *sif. dan.* Gözləri qabağa doğru çıxıq olan; dombalangöz.

**QURBAĞALIQ** *is.* Qurbağalı göl, çən.

**QURBAĞAOTU** *is. bot.* Bataqlıq yerlərdə bitən, bəzi növləri xalq təbabətində işlədilən çoxillik bitki. *Poruq və ya qurbağaotu .. növü bataqlıqlarda bitir. Kökü unlu və ətirlidir, bişmiş halda çox ləzzətli olur..* M.Qasımov.

**QURBAN** *is.* [*ər.*] 1. Dini adətlərə görə, Allah yolunda kəsilən qoyun və ya başqa bir heyvan. ☐ **Qurban bayramı** – hicri ilin sonuncu ayında müsəlmanların qurban kəsdikləri dini bayram. **Qurban kəsmək** – həmin mərasimi icra etmək. *Bugünkü qonaqlıq* – "*qurban kəsmə*" *Həmzənin idi. Pir üstündə o bu gün bir neçə qoyun kəsmiş, böyük ziyafət vermişdi.* Ə.Əbülhəsən. *İnqilabdan əvvəl quraqlıq olan illər camaat .. müsəllaya çıxıb, çoxlu qurban kəsmiş.* Ə.Vəliyev.

2. Xalq arasında: hər hansı bir əlamətdar hadisə münasibəti ilə qoyun kəsmə adəti. *Kəndlərdən qəhrəman Fəxrəddinin atının dırnağında qurban kəsmək üçün gətirilən sürü-sürü qoyunlar kəsilib soyulur.* M.S.Ordubadi.

3. Ən əziz, ən müqəddəs bir şey yolunda canından keçmiş, özünü fəda etmiş adam. *..Bizim Novruz bayramının ikinci günü Petroqrad şəhərində azadlıq yolunda şəhid olan azadlıq qurbanları dəfn olublar.* C.Məmmədquluzadə. ☐ **Qurban etmək (eləmək)** – 1) fəda etmək. *Müştaqiyəm, canı qurban elərəm; O xəttinə, o xalına, sevdiyim!* M.V.Vidadi. *Bir canım var, yara qurban eylərəm; El də desin aşıq qurban öldürür.* Aşıq Ələsgər; 2) könüllü surətdə başqasının xeyrinə bir şeyindən keçmək, əl çəkmək; canından-malından keçmək. **Qurban getmək** – ən əziz, ən müqəddəs bir şey uğrunda fəda olmaq, həlak olmaq, canını qoymaq. **Qurban olmaq** – b a x **qurban getmək**. // Nəvaziş, mehribanlıq, yaxud yalvarış mənasında. *Qurban, tez bunu apar. – Oxu, bülbülciyim, səsinə qurban! Ey ilham pərisi sevimli canan!* M.Rahim. **Qurban vermək** – ən əziz, ən müqəddəs bir şey yolunda öz canından, yaxud yaxın adamının canından və ya malından keçmək, fəda etmək. *Vətən yolunda canını qurban vermək.* // **Qurbandır** şəklində – xoş təklif, iltifat mənasında, yaxud xahiş edilən bir şeyi məmnuniyyətlə verməyə, güzəşt etməyə hazır olmağı bildirir. *– Nə gözəl şeydir! – Qurbandır!* – [Məmmədhəsən əmi:] *Baş üstə, baş üstə, qurbandı sənə eşşək. Bu saat gedim, özüm çıxardım.* C.Məmmədquluzadə. *Ay qardaş, sən xoş gəlmisən. Malım, dövlətim, evim, hamısı sənə qurbandır!* Qantəmir.

4. Bir hadisə nəticəsində həlak olmuş adam. *Yanğın qurbanları. Zəlzələ qurbanları.* // Hər hansı bir iş üzündən zərər çəkmiş, mənəvi iztirab və haqsızlığa məruz qalmış adam haqqında. *O, intriqa qurbanı oldu. Öz təcrübəsizliyinin qurbanı.*

◊ **Qurban(ın) olum!** – nəvaziş, mehribanlıq, yaxud yalvarış bildirir. *Çoxdandır ki, ibadətdən xaricəm; Səcdəgahım, bir sana qurban olum!* Aşıq Pəri. *Anası* [Nadirin] *ayıldığını görcək, qorxa-qorxa yanına gəlib başını sığalladı və sordu: – Qurban olum, bədənin ağrıyırmı?* B.Talıblı. *O yazan əlinə mən qurban olum! Gəl, gəz bağçamızı gül dərə-dərə.* S.Vurğun. [Gülsənəm:] *Sən özünə baxma, qurbanın olum!* M.Hüseyn. **Qurban kəsim!** – b a x **qurban olum! Qurban olasan..., qurban olsun...** – biri haqqında icra edilmək istənilən bir işin (cəzanın, tənbehin və s.) kimin (nəyin) sayəsində güzəşt edildiyini bildirir. *Qurban olsun gəncliyinə, yoxsa...*

**QURBANGAH** *is.* [*ər.* qurban və *fars.* ...gah] Qurban kəsilən yer. *Yaz və yay gecələrində bu lampalar eyni ilə bir qurbangah kimi idilər.* Ə.Məmmədxanlı.

**QURBANLIQ** *sif.* 1. Qurban kəsilmək üçün saxlanmış, ayrılmış. *Vaqif, oğlunun qurbanlıq qoyunu kimi yerə uzandırıldığını gördükdə qışqırdı.* Çəmənzəminli. *Ay yazıq, bilmirsənmi, qurbanlıq qoyuna qənd yedirərdilər, xına yaxar, gözünə sürmə çəkərdilər?* Ə.Əbülhəsən.

2. Özünü, yaxud başqasını qurban vermə, canından keçmə. [Solmaz:] *Bütün xalqın nicatı üçün mənim qurbanlığım gərəksə, mən çəkinməyəcəyəm.* C.Cabbarlı.

**QURBAN-SADAĞA** *dan.* b a x **sadağa**.

◊ **Qurban-sadağa getmək** – həddindən artıq əzizləmək, oxşamaq, nazlamaq.

**QURCALANMA** "Qurcalanmaq"dan *f.is.*

**QURCALANMAQ** *f. dan.* Qurdalanmaq, yerindəcə tərpənmək, o yan-bu yana çevrilmək (çox vaxt "yerində" sözü ilə). *Mürsəl kişi utancaq gözlərini Məryəmə zilləyib yerində qurcalandı.* M.Hüseyn. *Nəbi ailəsinə sabah haradan çörək tapacağını düşünür, yerində qurcalanırdı.* Ə.Abasov.

**QURCANMA** "Qurcanmaq"dan *f.is.*

**QURCANMAQ** b a x **qurcalanmaq**. *Kazım yerində qurcandı, diqqətlə oğlana baxdı, utancaq bir təbəssüm üzünə yayıldı.* Çəmənzəminli.

**QURCUXMA** "Qurcuxmaq"dan *f.is.* ☐ **Qurcuxma düşmək** – narahatlıq və maraq əlaməti olaraq hamı yerindəcə hərəkət etmək, tərpəşmək.

**QURCUXMAQ** *f. dan.* Bir yerdə sakit oturmayıb tez-tez çevrilmək, qurdalanmaq. *Səfər yerində qurcuxur, sonra yenə gözlərini ulduzlara dikərək, qəlbini dinləməyə başla-*

*yırdı*. Çəmənzəminli. *Yarım saat keçmədi ki, yenə topalın qurcuxduğunu sezdim.* Mir Cəlal.

**QURCUŞMA** "Qurcuşmaq"dan *f.is.* "*Böyük düz*" *yiyələrinin arasında yenə qurcuşma düşdü.* Ə.Əbülhəsən.

**QURCUŞMAQ** b a x **qurcuxmaq**.

**QURD[1]** *is.* Canavar. *Düşdü qəzadan ora qurdun yolu; Baxdı ki, görsün, quyu boşdur, dolu*. A.Səhhət. *Qurd da öz yerini qaranlıq istər ki, onu heç görən olmasın, o da əlinə keçəni dağıdıb gəmirsin, sümüklü-sümüklü, qanlı-qanlı udsun.* S.Rəhman. // *məc.* Təşbehlərdə. [Hacı Murad:] *Mən olmuşam bir leş, siz olmusunuz bir ac qurd*. S.S.Axundov. [Vaqif:] *Xalq razı qalmasa bir hökmdardan; Hakimi qurd kimi didəcək zaman*. S.Vurğun. [Qazanxan:] *Gördüm ki, .. qara quduz qurdlar evimi dəlir*.. M.Rzaquluzadə. ◊ **Qurd nağılı** – vaxt keçirmək üçün danışılan aldadıcı sözlər. **Qurd ürəyi yemək** – cəsarətli olmaq, qorxmamaq, ürəkli olmaq. *..Bax, indi düşmənlə dalaşmaq vaxtı gəlib çatmışdır. Oğlan oldu, ya qız, gərək yeri gələndə qurd ürəyi yemiş olsun*. S.Rəhimov. **Qurd yağı** – mövhumata inananların etiqadına görə, guya iki yaxın adamı və ya qohumu bir-birinə düşmən etmək, yaxud birbirindən ikrah etdirmək qüvvəsinə malik olan maddə (buna nail olmaq üçün bu maddəni onların paltarına sürtmək və ya onların evlərinin astanasında basdırmaq kifayət imiş). [Nurcahan:] *Belə olan surətdə, balam, yəqin ki, oğlana qurd yağı sürtüblər.* N.Vəzirov. **Qurdla qiyamətə qalmaq** *zar. kin*. – çox yaşamaq, ölməmək, həmişə yaşamaq (adətən inkar şəklində işlənir). *Ona bir deyən yoxdur ki, ay arvad, qurdla qiyamətə qalmayacaqsan ki*.. S.Rüstəm. **Qurdla quzu bir yerdə, yaxud qurd quzu ilə otlayır** – çox sakitlikdir, dinclikdir, əmin-amanlıqdır. *..Guya müxbirimiz oradan yazır ki,* "*sakitlikdir, qurd quzu ilə otlayır*". C.Məmmədquluzadə. **Qoyun cildinə (dərisinə, donuna) girmiş qurd** – öz pis niyyətlərini xeyirxahlıq pərdəsi altında gizlədən qəddar, riyakar adam haqqında. **Gözünün qurdu ölmək** – b a x **göz**. **Köhnə qurd** – heç bir hiyləyə aldanmayan, uymayan, hiyləgər, təcrübəli, ayıq, zirək adam haqqında. *O, köhnə qurddur, onu aldatmaq olmaz.*

**QURD[2]** *is. zool.* Yumşaq bədənli, uzunsov, ayaqsız, sürünərək hərəkət edən kiçik heyvan. *Formaları, rəngləri, növləri, böyüklükləri və yaşayış tərzləri xeyli müxtəlif və qəribə olan minlərlə qurd növü dənizin səthindən tutmuş dibinə qədər hər bir yerində yaşayır*. "Sualtı aləm". "*Qurdlar*" *mövzusunu keçərkən ən əlverişli obyekt diri soxulcan hesab olunur*. Cəbrayılbəyli. *Kirpi bostanın qurdlarını yeyib tələf edər*. S.S.Axundov. □ **Qurd düşmək** – b a x **qurdlanmaq**. *Pendirə qurd düşmüşdür*. **Qurd yemək** – çürümək, pozulub xarab olmaq. *Göyçək bacının dediyinə görə, uşaq çox şirni sevdiyindən, dişlərinin hamısını qurd yemişdi*. Ə.Vəliyev.

**QURDABƏNZƏR** *sif.* Görünüşcə qurda (soxulcana) oxşayan.

**QURDAĞZI** *is. bot*. Çoxillik ot bitki; itağzı.

**QURDALAMA** "Qurdalamaq"dan *f.is.*

**QURDALAMAQ** *f.* 1. Bir şeyi əli ilə və ya başqa bir şeylə əlləşdirmək, yerindən tərpətmək, qarışdırmaq, o tərəf-bu tərəfinə toxunmaq. *Şeyləri qurdalamaq*. – *Rəhim bəy dodaqaltı gülümsədi, böyründəki maşanı götürüb manqalın közlərini qurdaladı.* M.Hüseyn. // Əli ilə araşdırmaq. [Fərhad] *sağ cibini qurdaladı. Bir loğma quru qara çörək tapdı.* Ə.Vəliyev.

2. Qaşımaq, toxunmaq, əlləşdirmək, qıcıqlandırmaq. *Yaranı qurdalamaq*.

3. *məc.* Təzələmək, üstünü açmaq, yaxud yaddan çıxmış bir şeyi təzədən yada salmaq. *Mən məsələni çox da qurdalamaq istəməyərək, intibahnaməni oxumağa başladım.* M.S.Ordubadi. *Keçmişlərini qurdalamaq, onu yaxından tanımaq arzusu gündən-günə artırdı.* A.Şaiq.

**QURDALANMA** "Qurdalanmaq"dan *f.is.*

**QURDALANMAQ** *f.* 1. Öz yerindəcə tərpəşmək, nə isə bir şeylə əlləşmək, məşğul olmaq, yüngülcə işləmək; sakit oturmamaq. *Binanın o biri başında, üst mərtəbənin balaca eyvanında Salman qurdalanırdı*. S.Rəhimov. *Yunis yaxınlaşanda ağac altında boz köynəkli, yaxası açıq bir kişinin qurdalandığını gör*(*dü*). Mir Cəlal. *Əsəd həyətdəki tərəvəzlikdə qurdalanırdı*. S.Rəhman.

2. *məch.* Təzələnmək, təzədən yada salınmaq. *Bu xatirənin qurdalanmağından nə fayda?* Ə.Əbülhəsən.

**QURDALAŞMA** "Qurdalaşmaq"dan *f.is.*

**QURDALAŞMAQ** *f.* Öz-özünə tərpəşmək, öz yerində qurdalanmaq. *Asta-asta dəbərib qurdalaşırsan, deyəsən; Bəzi əfsanəçilərlə yanaşırsan, deyəsən*. M.Ə.Sabir.

**QURDAOXŞAR** b a x **qurdabənzər**.

**QURDBAĞRI** *is. bot*. Meşələrdə geniş yayılmış bir kol bitki; birgöz. *Birgöz və ya qurdbağrı .. Azərbaycan meşələrində geniş yayılmışdır. Hündürlüyü 3 m-ə qədər olan koldur*. M.Qasımov.

**QURDBASAN** *is.* İri çoban iti.

**QURDBOĞAN** *is. bot*. Acı və zəhərli şirəsi olan bir bitki, ot.

**QURDEŞƏNƏYİ** *is. dan.* 1. Bir-birinə qarışdırılmış, alt-üst edilmiş şey və ya yer haqqında. *Bu nədir, elə bil qurdeşənəyidir, hər şey alt-üst edilmişdir.*

2. Bədən ətinin parça-parça qızarmasından ibarət xəstəlik.

**QURDKOLU** *is. bot*. Paxlalılar fəsiləsindən kol bitki.

**QURDQOVAN, QURDQOVUCU** *sif. tib*. İnsan, ya heyvan bağırsaqlarındakı qurdları çıxaran (dərman və s.). *Alimlərimiz tərəfindən qankəsici, qurdqovucu, ödqovucu, qusdurucu təsirə malik bir sıra dərman bitkiləri də öyrənilmişdir*.

**QURD-QUŞ** *top*. Həşərat, cücülər. *Toyuq cücələri ilə o ağaclıqda gəzişir, qurd-quş, çəyirtkə tutub yeyir və çalaların altında eşələnirdi.* A.Şaiq.

**QURDLAMA** "Qurdlamaq"dan *f.is.*

**QURDLAMAQ** *f.* Bala doğmaq, balalamaq (qurd haqqında).

**QURDLANDIRMA** "Qurdlandırmaq"dan *f.is*.

**QURDLANDIRMAQ** *f.* Bir şeyi çox saxlayaraq qurdlanmasına, qurd düşməsinə səbəb olmaq; iyləndirmək. *Pendiri qurdlandırmaq. Əti qurdlandırmaq*.

**QURDLANMA** "Qurdlanmaq"dan *f.is.*

**QURDLANMAQ** *f.* 1. Çox qalmaqdan, istidən, yaxud başqa bir səbəbdən qurd düşmək, iylənmək. *Pendir qalıb qurdlanıbdır.*

2. *məc. dan*. Paxıllıq etmək, ürəyində paxıllığını çəkmək.

**QURDLATMAQ** b a x **qurdlandırmaq**.

**QURDLU** *sif.* 1. Qurd düşmüş, qurd dəymiş. *Qurdlu alma. Qurdlu pendir*.

2. *məc.* Kinli, qəlbiqara, paxıl. *Qaragünün dərdi böyük idi. Onun gözü ac, ürəyi qurdlu idi.* M.Rzaquluzadə.

**QURDLUQ** *is.* Canavarlıq, vəhşilik, yırtıcılıq. *Qurd doğulduğu zaman qurdluq xasiyyəti ilə yox, yalnız qurdluq şəkli ilə doğulur.* M.S.Ordubadi.

**QURDLULUQ** *is.* Qurd düşmüş şeyin halı.

**QURDOTU** *is. bot.* Paxlalılara mənsub yabanı bir bitki.

**QURDU-QURDU** *is. dan*. Həyəcan, yaxud narazılıq əlaməti olaraq gizli danışma, deyinmə, qeybət etmə. ☐ **Qurdu-qurduya düşmək** – həyəcan, yaxud narazılıq əlaməti olaraq gizli danışmaq, deyinmək, qeybət etmək.

**QURDURMA** "Qurdurmaq"dan *f.is.*

**QURDURMAQ** "Qurmaq"dan *icb*.

**QURĞAN** *is. məh*. Hasar; böyük və hündür barı.

**QURĞU¹** *is.* Bir yerdə qurulmuş mexanizm, maşın, cihazlar sistemi və s. texniki avadanlıq. *Orda keşik çəkən bütün fəhlələr; Gözü tək qoruyur bu qurğuları*. S.Vurğun. // Hər hansı bir işi, əməliyyatı icra etmək üçün vasitə ola bilən alət, cihaz, tərtibat, vəsait. *İdman qurğuları*.

**QURĞU²** *is. dan.* 1. Büsat, təntənə, dəsgah. *Çərxin gərdişindən bimürvət fələk; Sitəmindən necə canlar itibdir; zülmünü aşikar qıldın nümayan; Qurğular pozulub, sanlar itibdir*. Aşıq Ələsgər.

2. Hiylə, kələk, dolab, əl altından hazırlanan tələ. *Sübhanverdizadə tələdən sağ-salamat çıxan Dəmirov üçün yenə də ayrı-ayrı qurğular düşünürdü.* S.Rəhimov. ☐ **Qurğu qurmaq** – birinə qarşı gizlindən tələ hazırlamaq, hiylə düzəltmək, biclik işlətmək. *İşdi .. birdən tutulsam, onda bir qurğu qurub Koroğlunu Bayazidə göndərəcəyəm.* "Koroğlu". [Hacı Əli:] *Bax, bizi yoxlamaq üçün belə qurğular qurulur*. P.Makulu.

**QURĞUŞUN** *is.* 1. Göyə çalar bozumtul rəngli çox ağır yumşaq metal. *Ərgin qurğuşun. Mətbəə hərfləri qurğuşundan tökülür. – Ayrı-ayrı kimyəvi elementlərdən alüminium, sürmə, volfram, nikel, kobalt, qurğuşun və*

*radioaktiv metalların yeni yataqlarının axtarışı xüsusi əhəmiyyət kəsb edir*. M.Qaşqay. ◻ **Qurğuşun rəngi** – tutqun. *Qurğuşun rənginə çalan buludlar şəhər üzərindən ağır-ağır gəlib ötdükcə, elə bil dənizlə göy qovuşurdu*. M.Hüseyn. // Qurğuşundan qayrılmış. *Qurğuşun güllə. Qurğuşun boru.*

2. Tüfəng və tapança gülləsi.

3. *məc.* Çox ağırlıq mənasında. [Hacı Qara:] *..Qədək, şilə verənin əli qurğuşun imiş, üç aydır .. beş top satmışam.* M.F.Axundzadə. *Axı niyə Zərintac xanım öz ərinin başına belə bir qurğuşun qapaz salmaqla bu qədər ağ eləsin?!* S.Rəhimov. [Qaraca çobanın] *başı qurğuşun kimi ağırlaşmış, qulaqları uğuldayır, bədəni uçunurdu*. M.Rzaquluzadə.

**QURĞUŞUNLAMA** "Qurğuşunlamaq"dan *f.is.*

**QURĞUŞUNLAMAQ** *f. tex*. Qurğuşuna tutmaq, üzərinə qurğuşun çəkmək, qurğuşunla örtmək, qurğuşunla işləmək.

**QURĞUŞUNLANMA** "Qurğuşunlanmaq"-dan *f.is.*

**QURĞUŞUNLANMAQ** 1. *t-siz*. Qurğuşuna çevrilmək, qurğuşun kimi olmaq.

2. *məch.* İçinə qurğuşun tökülmək, yaxud qurğuşunla suvanmaq, qurğuşunla örtülmək, üzərinə qurğuşun çəkilmək.

**QURĞUŞUNLAŞMA** "Qurğuşunlaşmaq"-dan *f.is.*

**QURĞUŞUNLAŞMAQ** *f.* Qurğuşuna dönmək, qurğuşun kimi olmaq.

**QURĞUŞUNLU** *sif.* Tərkibində qurğuşun olan, qurğuşun qatışığı olan.

**QUR-QUR[1]** *təql.* 1. Qarın quruldaması, bağırsaqların içindəki qaz və ya mayenin hərəkətindən qarında hasil olan səs.

2. Qurbağaların çıxardığı səs, quruldama.

3. Boğazı dar qabdan tökülərkən mayenin çıxardığı səs. // Sulu qəlyanı çəkərkən, küpünün içində hasil olan səs.

4. Qarışıq, anlaşılmaz danışıq, səs. Qur-qur salmaq.

**QUR-QUR[2]** *is. dan*. İçinə giləli meyvə yığmaq üçün ağac qabığından qayrılan boruşəkilli qab. *Uşaqlar qur-qurda çiyələk gətirmişdilər.*

**QURMA** 1. "Qurmaq"dan *f.is.*

2. *sif.* Qurulan, yaylı. *Qurma oyuncaq.*

**QURMAQ** *f.* 1. Yaratmaq, təşkil etmək, meydana gətirmək. *Yeni həyat, yeni məişət qurmaq*.

2. Tikmək, bina etmək, təsis etmək, inşa etmək, qayırmaq. *Sədd qurmaq. Zavod qurmaq. – İstehkamçı – mühəndis deməkdir. Yəni körpü tikəcək, yolları bərpa edəcək, səngər quracaqsınız.* Mir Cəlal. [Qaraca çobanın] *igid yoldaşları bir neçə möhkəm tiri çəkib bir-birinə bənd etdilər, körpü qurdular.* M.Rzaquluzadə.

3. Düzəltmək, tərtib etmək. *Məclis qurmaq. Süfrə qurmaq. Tələ qurmaq. Yas qurmaq. İki cümləni qura bilmir. – ..Qəzetlərdə yazırlar ki, Təbrizdə övrətlər mitinq qururlar, köhnə adətləri aradan götürürlər, islahat tələb edirlər*. C.Məmmədquluzadə. *Atam Kərim baba ilə alaçıq qurmağa getdi*. A.Şaiq. *Qaratoyuq tutmaq üçün at qılından cələ hörüb, bağda ağaclar altında çox xəzəl olan yerdə qururduq.* S.S.Axundov.

4. Bir şeyin üzərində əsaslandırmaq, təşkil etmək. *Planı real imkanlar əsasında qurmalı. İşləri yeni üsul ilə qurmaq. – ..Gələcək qohumluğu möhkəm əsaslar üstündə qurmaq üçün, o, Səliminin .. bəzi hərəkətlərini təshih etməli idi.* M.İbrahimov.

5. Xəyalında yaratmaq. *Cürbəcür fərziyyələr qurmaq. Xəyalında böyük-böyük planlar qurmaq*.

6. Saat və s. mexanizmlərin yayını burmaq və işə salmaq. *Saatı qurmaq. Patefonu qurmaq*.

**QURNA** *is.* 1. Çeşmə, hamam və s. kranı altında suyun tökülüb yığılması üçün daşdan və s.-dən düzəldilmiş kiçik hovuz. *Hamam, çeşmə qurnası*.

2. Kran. *Lüzum vaxtında qurnanı açırsan, pakizə su cari olur*. M.F.Axundzadə. [Xortdan:] *Divarlarda samovar qurnasına oxşar bir şey qoyubdurlar.* Ə.Haqverdiyev.

**QURNAZ** *sif.* Hiyləgər, aldadıcı, məkrli. *Təbiət qurnaz baqqallar kimi bizi aldadır.* C.Cabbarlı. *Bilirik, tülküdən daha qurnazsan; Dilində "qardaşlıq", əlində silah*. S.Vurğun. // Ayıq, aldanmaz, zirək.

**QURNAZCASINA** *zərf* Hiyləgərcəsinə, bic-bic. [Gülərin] *daima qurnazcasına gülümsəyən iri mavi gözləri vardı.* C.Cabbarlı.

**QURNAZLIQ** *is.* Hiyləgərlik, aldadıcılıq; məkr. *Nə etmək, qurnazlıqla* (z.) *edilən bu xəyanət dünyada birinci dəfə deyildir.* A.Şaiq. // Ayıqlıq, aldanmazlıq, zirəklik.

**QURS** [*ər.* qürs] 1. *is.* Yastı, dairə şəkilli şey, yuvarlaq şey; disk. *Ay qursu. – Günəşin qursu nədən yer yüzünə şölə verir?* Nəsimi.

2. *sif.* Həcmcə kiçik, vəzncə ağır.

**QURSAQ** *is.* 1. Gövşəyən heyvanların və quşların birinci mədəsi. // Ümumiyyətlə, mədə. ☐ **Qursağı boş** – ac.

2. İçinə sucuq və s. doldurmaq üçün nazik, quru bağırsaq. // Dəf, baraban və s. üzünə çəkilən nazik dəri.

◊ **Qursağı daralmaq** – 1) yeməməkdən arıqlamaq, üzülmək. *Aclıqdan uşağın qursağı daralar, fikri ilə anası ona yanaşaraq: – Oğlum, .. qalx, qalx, yeməyini ye, – deyərdi.* A.Şaiq; 2) *məc.* ürəyi sıxılmaq, canı sıxılmaq.

**QURSAQCIQ** *is.* Kiçik qursaq.

**QURSAQLI** *sif.* 1. Qursağı olan.

2. *məc. dan.* Ürəkli, cəsarətli, qorxusuz.

**QURSAQLIQ** *is. anat.* Qarında qursağın yerləşdiyi boşluq.

**QURŞAQ** *is.* 1. Beli sıx tutmaq üçün ona sarılan uzun və dar parça; belbağı. *Qurşaq da, bilirsən ki, on arşın gərək olsun..* M.Ə.Sabir. *Məhəmmədhəsən əlini eşşəkçinin qurşağına salıb çəkə-çəkə aparırdı.* C.Məmmədquluzadə. *Hacı Salman çubuğunu qurşağına sancdı, konka sürənin yerinə çıxdı.* M.S.Ordubadi. // Sarğı, ip və s. *Göndərilən kitablar başıbağlı qalıb, kəsilmir və ruznamələr qurşaqdan çıxmır.* F.Köçərli .

2. Bel. *Qurşağından yapışmaq. Qurşağa qədər suya batmaq. Qurşağa qədər palçıq vardır. Bədəni hər gün qurşağa qədər soyuq su ilə yumaq xeyirlidir. – Burada yaz zamanı qurşağa qədər ot olur.* İ.Əfəndiyev.

3. *xüs.* Bir şeyin belini dövrələmək üçün metaldan və s.-dən qayrılmış kəmər; çənbər. *Çəlləyin qurşağı. Binanın qurşağı.*

4. *coğr.* Yer kürəsi səthinin iki meridian arasındakı hissəsi. *Bütün Yer kürəsi meridianlarla 24 qurşağa, ya zonaya bölünür. – Avropa, demək olar ki, tamamilə mülayim qurşaqda yerləşən yeganə qitədir.* “Qitələr coğrafiyası”. // Ölkə ərazisinin, hər hansı bir əlamətinə görə, müəyyən bir qismini təşkil edən hissəsi. – *Hündürlüyü 1000 m-dən artıq olan relyef ünsürləri dağ qurşağını təşkil edir..* [Miçurin] *şaftalı kimi dadlı, zərif ətirli bir meyvə bitkisini Rusiyanın orta qurşaqlarında yetişdirmək istəyirdi.* M.Axundov.

◊ **Qurşağa çıxmaq** – həddi aşmaq (bir şeyin çoxluğunu, bolluğunu bildirir). *Qar qurşağa çıxırdı. – Söz uzansa həcv çıxar qurşağa; Sözün dalın çox uzatma, hayıfsan!* Aşıq Ələsgər. *Bu minval ilə yeddi gün keçdi. Bu yeddi günün ərzində plov qurşağa çıxdı..* Ə.Haqverdiyev. **Qurşağının altını bərkitmək** *zar.* – qarnını doydurmaq, yemək. [Cahangir bəy:] *..Xəlil, sən də gəl otur, qurşağının altını bərkit, balam!* N.Vəzirov. **Qurşaq tutmaq (yapışmaq)** – güləşmək.

**QURŞAQLAMA** “Qurşaqlamaq”dan *f.is.*

**QURŞAQLAMAQ** *f.* 1. Qurşaqla bağlamaq, qurşaq geydirmək, qurşaq keçirmək, qurşaq vurmaq, çənbərləmək.

2. Birinin qurşağından yapışmaq (güləşmə üsulu).

**QURŞAQLANMA** “Qurşaqlanmaq”dan *f.is.*

**QURŞAQLANMAQ** 1. *qayıd.* Belinə qurşaq bağlamaq.

2. *məch.* Qurşaq bağlanmaq, qurşaq geydirilmək, qurşaq keçirilmək, qurşaq vurulmaq, çənbərlənmək.

3. *məc. dan.* Bir işə hazırlanmaq, bir işə başlanmaq, ... qəsdində olmaq.

**QURŞAQLANMIŞ** *f.sif.* Qurşaq çəkilmiş, qurşaq keçirilmiş, çənbərlənmiş. *Qurşaqlanmış çəllək.*

**QURŞAQLAŞMA** “Qurşaqlaşmaq”dan *f.is.*

**QURŞAQLAŞMAQ** *qarş.* Bir-biri ilə qurşaq tutmaq, güləşmək. *Onlar* [İsmayıl və Nifti] *əl tutdular. Əvvəlcə sağ, sonra sol çiyinlərini bir-birinə vurdular. Beləliklə, güclərini sınadıqdan sonra qurşaqlaşdılar.* Ə.Abasov.

**QURŞAQLI** *sif.* 1. Belində qurşaq olan, belinə qurşaq bağlamış. *Qurşaqlı qoca.*

2. Qurşaq vurulmuş, qurşaq keçirilmiş; çənbərli. *Qurşaqlı çəllək. – Bir yandan da gurultu ilə dükanların dəmir qurşaqlı qapıları bağlanırdı.* Ə.Əbülhəsən.

**QURŞAQLIQ** *sif.* Qurşaq üçün yararlı. *Qurşaqlıq parça. Qurşaqlıq dəmir, ağac.*

**QURŞAQTUTAN** *is.* Güləşən, pəhləvan. *Hərdən İrandan, Ərdəbildən, Sarabdan nüfuzlu, adlı qurşaqtutanlar da gələrdi.* H.Sarabski.

**QURŞAMA** "Qurşamaq"dan *f.is.*

**QURŞAMAQ** *f.* 1. Belinə bağlamaq. *Koroğlu qılıncını qurşadı, .. tərlan kimi Qıratın belinə sıçradı.* "Koroğlu". *Əcəb qurşayıbdır incə belinə; Gümüş kəmər qəddi-dala yaraşır.* Aşıq Ələsgər. *Səsimə səs versin bütün ölkələr; Qoy qılınc qurşasın müstəmləkələr.* S.Vurğun.

2. *məc.* Dolamaq, ələ salmaq, araya qoymaq, oynatmaq. *İstəyirlər özək katibini heçə döndərib, Xədicə Soltanı qurşasınlar.* Mir Cəlal.

**QURŞANMA** "Qurşanmaq"dan *f.is.*

**QURŞANMAQ** *f.* 1. *qayıd.* Belinə qurşaq, kəmər və sairə bağlamaq. [Tükəz:] *Yəni sən bu yaraqları qurşanıb, onlar ilə adam qorxudacaqsan?* M.F.Axundzadə. *Sizin ilə canlanır yeni əsrin həyatı; Qurşandığın silahla parlat bu kainatı.* A.Şaiq.

2. *məc.* Girişmək, başlamaq, qoşulmaq, məşğul olmaq; bir işə həddindən artıq qapılmaq; özünə sənət etmək. [Şəhrəbanı xanım:] *Sənin kimi cahıl uşaqlar subay qalmaqdan tamam yaman yollara düşər, oğurluğa, quldurluğa qurşanar.* M.F.Axundzadə. *Musanın nəvəsi qəzada qalıb, atasının ortağı ilə ticarətə qurşandı.* Qantəmir. [Arvadlar] .. *oxuyublar, işə girişiblər, kluba, iclasa qurşanıblar*. Mir Cəlal.

**QURŞATMA** "Qurşatmaq"dan *f.is.*

**QURŞATMAQ** *icb.* Qurşanmağa məcbur etmək.

**QURŞUN** bax **qurğuşun** 2-ci mənada. *Fəqət hərbin o səfalı həngamında bir qurşun; Gəlib dəydi sağ qoluna, etdi onu qərqixun.* A.Səhhət. *Qurşunumuz getməz boşa; Oxlarımız dəyməz daşa.* A.Şaiq. [Nadir:] *..Müharibə zamanı üzərimə minlərcə düşmən qurşunu yağdı da, heç qorxmadım*. B.Talıblı.

◊ **Qurşuna düzmək** *köhn.* – güllələmək.

**QURŞUNİ** *sif.* Qurğuşun rəngində, açıq kül rəngində.

**QURŞUNLAMAQ** bax **qurğuşunlamaq**.

**QURTAQURT** *təql.* Su və s. içərkən boğazdan çıxan səs. *Süfrələr açılır, adamlar badələrini bir-birinə vurur, daha damcı-damcı deyil, qurtaqurtla* (z.) *içirdi.* S.Rəhimov. *At ağzını bulağın daş novuna söykəyib qurtaqurtla* (z.) *su içir*. Ə.Vəliyev.

**QURTARACAQ** *is.* 1. Bir şeyin qurtaran yeri; son, nəhayət, axır. *Küçənin qurtaracağı. – Meşənin qurtaracağına iki verst qalmış bir atlı, yaraqlı adam Cəfərin qabağını kəsdi.* S.S.Axundov. *Yuxarı bazarın qurtaracağında qarşı-qarşıya tikilmiş iki karvansara vardı ki, bunlara qoşa karvansara deyərdilər*. H.Sarabski. // *Sif. mənasında*. Son, axır. *Bəzən bizə elə gəlir ki, bir-iki kilometr qabaqda baş-başa verib dərənin üstünü almış, sıldırım qranit qayalardan o yana yol yoxdur, ora dərənin qurtaracaq nöqtəsidir*. M.İbrahimov.

2. Nəticə, aqibət, son. *İşin qurtaracağı bəlli deyildir*.

**QURTARAN** bax **qurtarıcı**.

**QURTARICI** *is.* Xilas edən, xilaskar; təhlükədən və ya çətin bir vəziyyətdən qurtaran adam. *Ol kəman əbru xədəngi-qəmzə birlə bigünah; Kişvərini öldürür, kimdir anı qurtarıcı?* Kişvəri.

**QURTARICILIQ** *is.* Xilaskarlıq.

**QURTARILMA** "Qurtarılmaq"dan *f.is.*

**QURTARILMAQ** *məch.* Xilas edilmək, nicat verilmək. *Ölümdən qurtarılmaq. Girdabdan qurtarılmaq. Fəlakətdən qurtarılmaq.*

**QURTARIŞ** *is.* Qurtulma, xilas, nicat. *Ey süzən qumral qadın; Yazıqsan, süzmə belə; Qurtarış yoxdur sənə; Canımı üzmə belə.* Ə.Cavad.

**QURTARMA** "Qurtarmaq"dan *f.is.*

**QURTARMAQ** 1. *t-li*. Bitirmək, axıra çatdırmaq, tamamlamaq. *İşini görüb qurtarmaq. Məktəbi qurtarmaq. Söhbəti qurtarmaq. – Danışan qazmaçı bir neçə kəlmə ilə sözünü qurtardı*. M.İbrahimov.

2. *t-siz.* Bitmək, tamamlanmaq, axıra çatmaq. *İvanov mənə dedi ki, Kərbəlayı, .. yaxşısı budur ki, sənə taxtapuşda yer salaq, orada dava qurtarınca yat.* Çəmənzəminli. *İclas axşam saat 9-da qurtardı.* Ə.Vəliyev.

3. *t-siz*. Tükənmək. *Köhnə taxıl qurtarmışdır. Pullar xərclənib qurtarmışdır*.

4. *t-li*. Xilas etmək, azad etmək, nicat vermək. *Dənizdə boğulanı qurtarmaq. O,*

*yoldaşını ölümdən qurtardı. – Mey götür, saqi, məni qurtar nəmazü rövzədən; Kim, mən ol zöhdü riyadən tövbəkarəm, doğrusu.* Kişvəri. *Dünyada elə sular var ki, insanı ölümdən qurtarar, məsələn, Qafqazda mədən suları.* C.Məmmədquluzadə. [Ağa:] *Axır neçə nəfər əliağaclı gəlib məni itlərin ağzından qurtardılar.* Ə.Haqverdiyev. // *t-li.* Ağır, çətin, pis, çıxılmaz vəziyyətdən çıxarmaq. [Odunçu oğlu:] *O qız xeylağı ki burda əsirdir, baba onu da qurtarmaq üçün mənə kömək eləsəydin...* Ə.Məmmədxanlı.

5. *t-siz.* Xilas olmaq, özünü xilas etmək, qurtulmaq, nicat tapmaq. *İran şahları və başqaları .. düşməndən qaçıb qurtarmaq məqsədi ilə bu əcaib ölkəsi olan Qafqaza pənah gətirirdilər.* A.Bakıxanov. *Kürəkçilər bu ağır əzabdan, bu ömürlük zindandan .. qurtarmaq üçün yeganə bir çarə tapmışdılar.* M.Rzaquluzadə. *Bir nəfərin zindandan qurtarması ..* [Firidunu] *sevindirdi.* M.İbrahimov.

6. *t-siz.* Ölmək, keçinmək. *Xəstə artıq qurtardı. – Amma anam onların köçməyini eşitcək, qurtaracaq, yəqin bil ki, haman dəqiqə keçinəcək.* C.Məmmədquluzadə.

◊ **Qurtardı getdi!** – vəssalam! [Mirzə Səməndər:] *Bu məktəbin ixtiyarı məndədir, yox? Çıxart bu saat bu maşınları buradan, qurtardı getdi!* C.Cabbarlı. **Sözün qurtaranı** – deyilənlərə yekun vurmaq üçün işlənir – xülasə, müxtəsər, bir sözlə. *Sözün qurtaranı, məndən döyə-döyə dörd manat alıb yola saldılar.* C.Məmmədquluzadə.

**QURTARMAZ** *sif.* Bitməz, qurtarmayan, axırı olmayan, axırı görünməyən. *Qurtarmaz iş. Qurtarmaz mübahisə.*

**QURTARMAZLIQ** *is.* Bitməzlik; bitməyən, qurtarmayan şeyin xassəsi, halı.

**QURT-QURT** *təql.* Darboğazlı qabdan maye tökülərkən, yaxud su və b. maye içərkən boğazdan çıxan səs.

**QURTULDAMA** “Qurtuldamaq”dan *f.is.*

**QURTULDAMAQ** *f.* Qurt-qurt etmək. *Ağanın boğazı qurtuldadı.* S.Rəhimov.

**QURTULDATMA** “Qurtuldatmaq”dan *f.is.*

**QURTULDATMAQ** *f.* Qurt-qurt içmək və ya tökmək. *Qarı stəkanının son damlasını da qurtuldadıb* [dedi:] *– Allah ağzını şirin eləsin!* S.Rəhimov. // Qurt-qurt yemək (duru xörəyi). *Mən qana bilmirəm, mümkün olan işdirmi, düşbərəni qurtuldadım, qonşum acından kəpək qussun..* N.Vəzirov.

**QURTULMA** “Qurtulmaq”dan *f.is.*

**QURTULMAQ** *f.* Xilas olmaq, azad olmaq, nicat tapmaq; canını xilas etmək. *Can nə quşdur ki, qurtula deyəsən; Ənbərin zülfünün duzağından.* Nəsimi. [Əvvəlinci ərizəçi:] *..Bu gün atımı çaya suvarmağa aparmışdım; birdən əlimdən qurtuldu, qaçdı.* M.F.Axundzadə. *Qızılquş pəncəsindən qurtulub özünü insan əlində əsir görən kəklik, qurtulmaq üçün həyəcanla çırpınır, əllərimizi dimdikləyirdi.* A.Şaiq. [Qorxmaz:] *Biz bu ərəb yırtıcılarından, bu vəhşi elbəyilərdən qurtulmalıyıq.* C.Cabbarlı.

**QURTULUŞ** *is.* Xilas, nicat, azadlıq; azad olma, xilas olma, nicat tapma. *Qurtuluş bayramı. – Əlində tutduğun o böyük məşəl; Göstərir aləmə qurtuluş yolu.* S.Vurğun. *Qələbələrimiz bütün dünyada sülh və azadlıq cəbhəsinin ən möhkəm dayağıdır, insanlığın qurtuluş arzularını çiçəkləndirən günəş işığı qədər ürəkaçıcı və fərəhlidir.* M.İbrahimov.

**QURTUM** *is.* Adətən saylarla: **bir qurtum** – bir içim, bir udum. *Bir qurtum su.* – [Gülcahan:] *Üç gündür ki, nə onun, nə də mənim boğazımdan bir qurtum su da keçməyibdir.* N.Vəzirov. *Allahqulu piyaləni dodaqlarına yapışdırıb, bir qurtum aldı..* Çəmənzəminli. *Hacı Səməd çaydan bir neçə qurtum içib başladı..* S.S.Axundov.

**qurtum-qurtum** *zərf Çaydan qurtum-qurtum içmək. – Cahandar ağa qurtum-qurtum içdiyi çayı qurtardı, boş stəkanı nəlbəkiyə qoyub, əlini güllü atlasa uzatdı.* İ.Şıxlı.

**QURTUMLAMA** “Qurtumlamaq”dan *f.is.*

**QURTUMLAMAQ** *f.* Qurtum-qurtum, yaxud bir-birinin dalınca içmək.

**QURU**[1] *sif.* 1. Yaş olmayan, islanmamış. *Quru paltar. Quru dəsmal.* // Qurudulmuş. *Quru meyvə. Quru balıq. – Mahmud .. quru ot-ələf yığılmış çardağın altına girdi.* Ə.Əbülhəsən. // Qurumuş, ölgünləşmiş, həyat şirəsindən məhrum olmuş. *Quru budaq. – Onların bir neçəsi meşəyə gedib, quru ağac qabıqlarından, çalıdan-çırpıdan yığıb gətirdilər.* M.Rzaquluzadə. // Şirəsiz. *Quru yem. – Heyvanın ağzına quru qida düşərsə,*

*tüpürcək miqdarca çox, su ilə zəngin olur; qida quru və qaba olduqda, ifraz olunan tüpürcəkdə selik maddəsi çox olur.* Qarayev.

2. Rütubətsiz, rütubəti çəkilmiş, nəm olmayan. *Quru torpaq. Quru otaq. Quru taxta. – Heç yata bilməzdin ipək yataqda; Bəs necə dincəldin quru torpaqda?* Ə.Cavad.

3. Qalıb bərkimiş, sərtləşmiş; köhnə, bayat. *Quru bulka. Quru lavaş.* – [Əsgərin] *yediyi, içdiyi həmişə dişləmə çay ilə quru çörək idi*. B.Talıblı.

4. Susuz, suyu çəkilmiş. *Quru çay. Quru bulaq. Quru arx.*

5. Bitkisiz, çılpaq, yaşıllıqsız. *Dağda, dənizdə, quru çöllərdə, ormanda yaşayan canlı heyvanlar, onların yeyib içməsi və şəkilləri də fərqlidir.* M.S.Ordubadi. *Gün altında qovrulan böyük quru çöldə təndirdən qalxan kimi ağır və isti hava insanın vücudunu bürüyürdü.* Mir Cəlal.

6. Yağmur yağmayan, isti, quraq; rütubətsiz, nəmişsiz. *Quru iqlim. Quru hava*.

7. Arıq, cılız, ətsiz-cansız, çox zəif. *Quru bədən. Quru qollar*. – [Nazlı xanım:] *Elə elə ki, mənim bu quru nəfəsim, quru canım həmişə sənə duaçı olsun*. Ə.Haqverdiyev.

8. Döşənməmiş, üstünə heç bir şey salınmamış; açıq, çılpaq. *Quru yer. Quru döşəmə. Quru taxtanın üstündə oturma!* // Bomboş, içində heç bir şey olmayan, müxəlləfatsız. *Belə əziz-giramı oğlun nişanlısı quru evə gəlməməli idi.* Mir Cəlal.

9. Sadə, qatıqsız, yavan, yalxı. *Quru yemək. – Bir də axı əlli yaşından ötmüş Topuş ömrünün bu çağında haraya gedib özünə bir parça quru çörək tapa bilərdi?* S.Rəhimov.

10. Maye ifrazatı olmayan. *Quru öskürək* (*bəlğəmsiz öskürək*). – [Sona xanım:] *Gecələr sübhədək quru öskürək məni boğur*. Ə.Haqverdiyev.

11. *məc.* Boş, nəticəsiz, qeyri-ciddi, təsirsiz. *Quru söz. Quru söhbət. – Yoxsa ki, etməz quru iktifa; İş gərək olsun, nə əbəs iddia.* A.Səhhət. *Bu, quru bir eşqnamə deyil, mənzum bir siyasətnamədir*. M.S.Ordubadi.

12. *məc.* Maraqsız, cansıxıcı, darıxdırıcı. *Onun üslubu çox qurudur. Məqalə quru dildə yazılıbdır. Bəzi müəllimlər dərsi çox quru* (z.) *və maraqsız keçirlər. – Daima qısqanan ürkək bir həyat; Məncə bu dünyada bir quru səsdir.* S.Vurğun.

13. *məc.* Soyuq, laqeyd, etinasız. *Quru cavab. – Dəmirov quru və tələbkar bir sifət aldı.* S.Rəhimov. *Bu səbəbdən də o, qısa, quru və sərt cavab verirdi.* Ə.Əbülhəsən.

14. *məc.* Açıq, əsassız. *Quru böhtan. – Yar olub özgələrə, yar çəkir zövqü səfa; Düşmüşəm mən quru böhtanlara, töhmət çəkirəm.* S.Ə.Şirvani. *Elm adına bir quru böhtandı bu! Nifrətə şayandı bu!* M.Ə.Sabir.

15. "Yalnız", "təkcə", "ancaq" mənasında. .."*Dəvəuçan*" .. *da sökülüb dağılmış, ondan ancaq bir quru ad qalmışdı.* S.Rəhimov.

◊ **Quru əl** – boş əl, kasıb, yoxsul hal. **Quru yerdə qalmaq** – var-yoxu əlindən çıxmaq, hər şeyindən məhrum olmaq, kasıblaşmaq. **Quru yerdə qoymaq** – var-yoxunu əlindən almaq.

**quru-quru** *zərf* Boş-boşuna, əsassız, yalandan, ortada heç bir şey olmadığı halda. *Quru-quru vədlər vermək.*

**QURU²** *is.* Torpaq, qitə, yer (*dəniz, su* müqabili). *Quruya çıxmaq. Quruda yaşayanlar. Quruda və dənizdə. Quru qüvvələri. Avropanın sahəsi bütün qurunun ancaq on beşdə bir hissəsini təşkil edir. – ..Biz cəld sudan çıxdıqda ilan da üstümüzə hücum edərək quruya çıxdı*. S.S.Axundov.

**QURUCA** *sif.* Çox quru, yaxud bir az quru. *Qara kişi .. bir-iki addım da geri çəkildi, yerə baxmaqda davam edərək, quruca cavab verdi*. Ə.Əbülhəsən.

**QURUCU** 1. *is.* Quran, tikən, bina edən, yaradan, təsis edən; müəssis.

2. *sif.* Yaradıcı. *Uşağı mübariz və qurucu həyata hazırlamaq lazımdır*. S.Rəhimov.

**QURUCULUQ** *is.* 1. Qurma, tikmə, bina etmə, yaratma, təşkil etmə, təsis etmə işi; yaradıcılıq. *Ölkə müharibəni qurtardıqdan sonra, dinc quruculuq yoluna keçməyə başladı. Atom enerjisi dinc quruculuq məqsədləri üçün istifadə olunmuşdur*.

2. İnşaat, tikinti. *Şəhərdə quruculuq və abadlıq işləri genişlənmişdir.*

**QURU-ÇÜRÜK** *is.* Tullantı, yaramaz, lazımsız şeylər.

**QURUDAN** *is.* Mürəkkəbi qurutmağa məxsus kağız, yaxud alət.

**QURUDUCU** 1. *sif.* Bir şeyi qurutmaq üçün işlənən. *Quruducu cihazlar. Bitkilər quruducu şkaflarda qurudulur. – ..Xüsusi quruducu sex yaradılmışdır ki, burada yüksək keyfiyyətli zəfəran telləri qurudulur.* İ.Axundzadə. // İs. mənasında. *Dərman bitki materiallarını 35-45° temperaturda müxtəlif quruducularda: sobalarda, çardaqlarda, dəmir örtüklü anbarlarda .. qurudurlar*. Əliyev.

2. Bax **qurudan**.

**QURUDULMA** "Qurudulmaq"dan *f.is. Yabanı dərman bitkilərinin toplanması və qurudulması.*

**QURUDULMAQ** *məch.* 1. Quru hala salınmaq; rütubəti, nəmliyi, suyu çəkilmək. *Paltarlar yaxşı qurudulmamışdır. Meyvələrin bir qismi qurudulmuşdur.*

2. *məc. dan*. Tamam içilmək, dibinədək içilmək. *Bütün stəkanlar qurudulду.*

**QURUDULMUŞ** *f.sif.* Quru hala salınmış. *Qurudulmuş meyvə.*

**QURULAMA** "Qurulamaq"dan *f.is.*

**QURULAMAQ** *f.* Yaş və islaq bir şeyi dəsmal və s. ilə silib quru hala gətirmək, yaşlığını rəf etmək; qurutmaq. *Bədənini qurulamaq. Başını qurulamaq. – Zöhrə suya çəkməkdə olduğu paltarı sərib qurtardı, əlini quruladı.* Ə.Vəliyev.

**QURULANMA** "Qurulanmaq"dan *f.is.*

**QURULANMAQ** *qayıd.* İslanmış, yaxud tərli bədənini dəsmal və s. ilə silib quru etmək. *Dəsmalla qurulanmaq. – ..Heç biri cürət edib ..* [Qazanxana] *yaxın obaların birində düşüb həm qızınıb qurulanmağı, həm də kömək üçün adam toplamağı təklif edə bilmirdi..* M.Rzaquluzadə.

**QURULATMA** "Qurulatmaq"dan *f.is.*

**QURULATMAQ** "Qurulamaq"dan *icb. Uşağı çimdirdikdən sonra qurulatmalı.*

**QURULAYAN** *is.* 1. Bax **qurudan**.

2. Bədəni qurulamaq üçün böyük dəsmal və s.

**QURULDAMA** *is.* 1. "Quruldamaq"dan *f.is.*

2. Qurbağaların çıxardığı səs. *Qurbağaların quruldamasından qulaqlarımız dəng oldu.*

**QURULDAMAQ** *f.* Qur-qur etmək. *Qurbağalar gölməçələrdə quruldayır*. – [Mehmanxanaçı] *müfəttişə yemək də vermir və biçarənin aclıqdan qarnı quruldayır*. F.Köçərli.

**QURULDAŞMA** "Quruldaşmaq"dan *f.is.*

**QURULDAŞMAQ** *qarş*. Hamısı birdən quruldamaq, səs-səsə verib quruldamaq. *Qurbağalar göldə quruldaşır.*

**QURULDATMA** "Quruldatmaq"dan *f.is.*

**QURULDATMAQ** "Quruldama"dan *icb*.

**QURULMA** "Qurulmaq"dan *f.is.*

**QURULMAQ** *məch.* 1. Yaradılmaq, təşkil edilmək, meydana gətirilmək. – [Almaz:] *Bu gözəl çəmənləri, çiçəkləri, bu sərin suları, bu yeni qurulan aləmi qoyub ölmək olar?* C.Cabbarlı. // Tikilmək, bina edilmək, inşa edilmək, təsis edilmək. *Sədd qurulmaq. Səngər qurulmaq. Zavod qurulmaq. – Yenə axar çaylar üzrə dəmir körpü qurulacaq; Yenə sahil lampaları alışacaq çıraq-çıraq*. S.Vurğun.

2. Əsaslandırılmaq. *Planlar həqiqi imkanlar əsasında qurulmuşdur. Roman həyatdan alınma hadisələr üzərində qurulmuşdur.*

3. Düzəldilmək, tərtib edilmək, hazırlanmaq, təşkil edilmək. *Danabaş kəndində üç yerdə matəm qurulubdur.* C.Məmmədquluzadə. *Həyətdə palaz döşənib samovar qurulmuşdu*. Çəmənzəminli. *Bir yay axşamında Rübabəgilin böyük zalında toy məclisi qurulmuşdu.* Mir Cəlal.

4. Yayı, mexanizmi burularaq işə salınmaq. *Saat axşamdan qurulmamışdır. – Hacı Ağa, bağışlayasız, mənim alafranqa saatım günortadan-günortaya qurulur*. C.Məmmədquluzadə.

**QURULTAY** *is.* Hər hansı bir təşkilat və ya ixtisas nümayəndələrinin ictimai-siyasi, yaxud elmi xarakter daşıyan geniş yığıncağı. *Həmkarlar ittifaqları qurultayı. Müəllimlər qurultayı. Sənaye işçilərinin qurultayı.*

**QURULTU** *is.* 1. Qarında, bağırsaqlarda əmələ gələn qur-qur səsi.

2. Qurbağaların çıxardığı qur-qur səsi. *Nəhrin sahillərindəki qurbağaların qurultusu yekrəng və həzin bir ahəng ilə bu xamuşluğu pozurdu*. H.Nəzərli.

**QURULU** *sif.* Qurulmuş, tərtib edilmiş, təşkil edilmiş, düzəldilmiş, hazır. *Qurulu ev. Qurulu süfrə. – Amma rəhmətlik mənim dədəm bir qurulu ev, bir də bu mal-qaranın birinci damazlığını verdi*. S.Rəhimov.

**QURULUQ** *is.* 1. Quru, yaxud qurumuş şeyin halı. *Paltarın quruluğu. Meyvənin quru-*

*luğu. Havanın quruluğu. – O, köksündə nə isə tənglik, bundan başqa boğazında da bir quruluq hiss edirdi*. Ə.Əbülhəsən.

2. Arıqlıq, cansızlıq, ətsizlik, zəiflik.

3. *məc.* Maraqsızlıq, darıxdırıcılıq. *Üslubun quruluğu. Bədii əsərin quruluğu.*

4. *məc.* Soyuqluq, sərtlik, laqeydlik, etinasızlıq. *Cavabın quruluğu.*

**QURULUŞ** *is.* 1. İctimai, dövlət sistem üsulu, idarə üsulu. *Quldarlıq quruluşu. Feodalizm quruluşu. Kapitalizm quruluşu. Demokratik quruluş. İctimai quruluş.*

2. Üsul, sistem.

3. Bir şeyin qurulma üsulu, təşəkkül forması, düzəliş qaydası, daxili tərtibatı; konstruksiya. *Bu maşınların quruluşu çox mürəkkəbdir. Dilin qrammatik quruluşu. Cümlə quruluşu.*

4. Bir tam təşkil edən hissələrin bir arada birləşməsi, təşəkkülü, düzülüşü. *Yer qabığının quruluşu. Atom quruluşu.*

**QURULUŞÇU** *is.* Teatr tamaşasının və ya kino filminin tərtibatına, qoyuluşuna rəhbərlik edən adam, rejissor; tərtibatçı.

**QURULUŞMAQ** *f. məh*. Bardaşını qurmaq. *Ocaqqulu koxaya yer düzəltdi, koxa quruluşub oturdu*. S.Rəhimov.

**QURUM**[1] *is.* Qurmaq işi, quruluş.

**QURUM**[2] *is.* 1. Sobaların, bacaların iç divarlarına yapışan, tüstüdən əmələ gələn qatranaoxşar kəsif maddə; his, duda, tüstü qarası. *Buxarı qurum oldu; Yandıqca qurum oldu; Hamının bir dərdi var; Mənə çox zülüm oldu*. (Bayatı). *İki şüşəli, qurum və toz basmış pəncərədə bir neçə hörümçək və milçək ölüsü* [vardı] N.Nərimanov. // Qapqara rəng mənasında. *Qaraşəhərin göyə ucalmış zavod bacalarından sakit-sakit qalxan tünd-qara tüstülər havanı qurum rənginə boyamışdı*. M.Hüseyn.

2. Paslanmış dəmiri döyərkən tökülən ovuntu.

**QURUMA** "Qurumaq"dan *f.is.*

**QURUMAQ** *f.* 1. Yaşlığı, islaqlığı, rütubəti, nəmliyi yox olmaq, quru hala düşmək. *Sərilmiş paltarlar qurudu. İstidən dodaqların quruyur. – Qurban bildi ki, ləyəndəki kəc quruyub zay olub..* C.Məmmədquluzadə. [Səriyyə xala] *bağırmaq və ağlamaq istəyir, bacarmırdı. Sanki gözlərinin yaşı qurumuşdu*. M.İbrahimov.

2. Günəşin istisindən, quraqlıqdan solmaq və ya torpaqdan qida almamaq nəticəsində tələf olmaq (bitkilər haqqında). *Həyətdəki güllərin hamısı qurudu. Tut ağacı qurumuşdur*.

3. *məc. dan*. Arıqlamaq, zəifləmək, üzülmək. *Yeməməkdən qurumaq. Dərddən qurumaq*.

4. *dan*. İflic olmaq, hərəkətdən qalmaq. *Onun bir tərəfi qurumuşdur*. // Bu mənada əmr şəklində qarğış kimi işlənir . *Əlin* (*ayağın, dilin*) *qurusun!*

5. Donmaq, hissiz bir hala gəlmək. *Şaxtadan bütün bədənim qurumuşdur. Küləkdən ayaqlarım qurudu*.

6. *məc.* Son dərəcə təəccüblənmək, mat qalmaq. *Elə bunu bilcək lap qurudum*. C.Məmmədquluzadə.

◊ **Quruyub daşa dönmək** – b a x **quruyub qalmaq**. *Təəccübdən* [Nadirin] *gözləri dörd oldu. Dimdik durub qapının ağzında dayandı. Sanki quruyub daşa döndü.* B.Talıblı. **Quruyub qalmaq** – 1) mat qalmaq, heyrətdə qalmaq, son dərəcə təəccüblənmək. *Bu işə lap quruyub qalmışam. – Hər kəs olduğu yerində quruyub qalmışdı.* M.S.Ordubadi; 2) hərəkətsiz durmaq, donub qalmaq. *Qısa adam, qarşısında quruyub qalmış bu səmimi vücudu başdan-ayağa süzdü.* H.Nəzərli. **Quruyub mat qalmaq** – b a x **quruyub qalmaq**. *..O biri tərəfdən də mənim barəmdə hər xüsusda onun sədaqəti gözümün qabağında durub, məni bu halətə gətirdi ki, öz-özümə quruyub mat qaldım.* C.Məmmədquluzadə. **Yerindəcə qurumaq** – b a x **quruyub qalmaq**.

**QURUMLAMA** "Qurumlamaq"dan *f.is.*

**QURUMLAMAQ** *f.* Qurum bağlamaq, qurumla örtülmək; his basmaq, his tutmaq.

**QURUMLANMA** "Qurumlanmaq"dan *f.is.*

**QURUMLANMAQ** *f.* Qurumla örtülmək, qurum basmaq, hislənmək, his bağlamaq.

**QURUMLATMA** "Qurumlatmaq"dan *f.is.*

**QURUMLATMAQ** *f.* Hisləndirmək; hislə, qurumla örtülməsinə səbəb olmaq.

**QURUMLU** *sif.* Qurum bağlamış, qurum tutmuş, qurumla örtülmüş. *Qurumlu baca. Qurumlu divar*. // Hisli. *Cındır piltəli saxsı çıraq qurumlu işıq verirdi*. S.Rəhimov.

**QURUMSAQ** *sif.* və *is. dan.* Namussuz, qeyrətsiz. // Bəzən zarafatla deyilir. *A qurumsaq, bəs bu nə işdir?* C.Məmmədquluzadə.

**QURUMSAQLIQ** *is. dan.* Namussuzluq, qeyrətsizlik; rüsvayçılıq, biabırçılıq. [Musa kişi:] *..Səhər bütün kəndi bura yığacağam. Bu yekəlikdə də qurumsaqlıq olar, siz eləyirsiniz?* M.İbrahimov.

**QURUMUŞ** *f.sif.* Quru hala gəlmiş. *Qurumuş ağac. Qurumuş çörək. Qurumuş torpaq. Qurumuş çay.* – [Mahirə] *qurumuş dodaqlarını dili ilə islatdı.* M.Hüseyn.

**QURUNMA** "Qurunmaq"dan *f.is.*

**QURUNMAQ** b a x **qurulanmaq**.

**QURUŞ** *is.* [əsli *ital.*] 1. Türkiyədə: lirənin yüzdə biri qiymətində olan pul.

2. Qəpik mənasında. [Nəcəf bəy:] *Nə vaxt sənin məndə iki quruşun batıbdır ki, yenə batsın.* Ə.Haqverdiyev.

**QURUT** *is.* Yumru-yumru edilib qurudulmuş şor, süzmə. *Aranda tutdan olduq, dağda qurutdan.* (Ata. sözü). *Mənim nəzərimi qurutu gözləyən uşaq cəlb etdi.* A.Divanbəyoğlu.

**QURUTMA** "Qurutmaq"dan *f.is.*

**QURUTMAQ** *f.* 1. İslanmış, yaxud nəmlənmiş bir şeyi quru hala salmaq, rütubətini, yaşlığını, nəmliyini yox etmək. *Paltarını qurutmaq. Günəş bir gündə yeri qurutdu. Bataqlıqları qurutmaq. Saçlarını qurutmaq.*

2. Öz təsiri ilə yandırmaq, soldurmaq, tələf etmək. *Günəşin istisi bütün bitkiləri qurutmuşdur. – Günəş səhər tezdən .. gözdən itənə qədər od kimi hər tərəfi yandırır və qurudurdu.* M.İbrahimov.

3. *məc. dan.* Arıqlatmaq, çox zəiflətmək, üzmək. *Xəstəlik onu tamam qurutmuşdur.*

4. Dondurmaq, hissiz bir hala salmaq, keyikdirmək. *Soyuq bütün bədənimi qurutmuşdur. – Şaxta qurutmuş bədənin sərbəsər; Zərrəcə yox hissdən onda əsər.* A.Səhhət.

◊ **Özünü qurutmaq** – sanki cansız, ruhsuz, dilsiz kimi dayanmaq. *Hərbi qulluqçular ayaqlarını cütləyib özlərini qurudaraq, nəfəslərini içəri çəkmişdilər.* M.İbrahimov.

**QUSÁR** [*mac.*] Çar ordusunda və bəzi xarici ölkə ordularında: macar forması geyinən süvari əsgər, ya zabit. [Qrinyov:] *Adının İvan İvanoviç Zurin, özünün isə qusar alayı rotmistri olduğunu öyrəndim.* Puşkindən.

**QUSDURMA** 1. "Qusdurmaq"dan *f.is.*

2. *sif.* Qusdurucu. *Qusdurma dərmanı.*

**QUSDURMAQ** *icb.* Qusmasına səbəb olmaq, yediyini qaytartmaq. *Bu yemək adamı qusdurur. Dərman yediyimi qusdurdu.*

**QUSDURUCU** *sif.* Qusduran. *Qusdurucu dərman.*

**QÚSLİ** [*rus.*] Çoxsimli qədim rus çalğı aləti. *Bu kəşfiyyat ayrı-ayrı xalqlarda əvvəlləri sadə və getdikcə təkmilləşən .. qusli, bandura, mandolina .. kimi müxtəlif növlü bir çox simli musiqi alətlərinin yaradılmasını təmin etdi.* Ə.Bədəlbəyli.

**QUSMA** "Qusmaq"dan *f.is.*

**QUSMAQ** *f.* Yediyini geri qaytarmaq, öyümək, sifraq etmək. *Yediyi balığı qusdu.* // Məc. mənada. *Bu əmrdə hakimi-vilayətlər şəbihdirlər zəlilərə ki, qan sorub şişdikdə sahibi oları sıxır, tamam sorduqları qanı qusarlar.* M.F.Axundzadə.

**QUSUNTU** *is.* Qusulan şey, geri gətirilən şey. *Mikroblar tüpürcək, asqırıq və ya qusuntu ilə yerə düşürlər.* N.Nərimanov.

**QUŞ** *is.* 1. Bədəni tük və ləléklə örtülü, ikiqanadlı, ikiayaqlı, dimdikli uçan heyvan sinfi. *Yırtıcı quşlar. Ev quşları. Oxuyan quşlar. Köçəri quşlar. Su quşları. – Quşlar yuvalarında oturub, dimdiklərini təmizləyirdilər.* N.Nərimanov. *Quşlar qayıdıb oxur təranə; Şaxlarda tikirlər aşiyanə.* A.Şaiq.

2. Ətlə dırnağın bitişdiyi yerdə ətdən aralanmış incə dəri hissəciyi.

◊ **Quş südü** – tapılmaz şey, heç yerdə mövcud olmayan xəyali bir şey. *İş tapmaq, necə deyərlər, quş südü tapmaq kimi bir şey idi.* P.Makulu. **Quş-quş olmaq** – bir-birinə bitişib aralanmamaq (kirpiklər haqqında). *..Bibim gəldi bizə, oğlanı naxoş görüb .. dedi: – Ay qız, baxıram, uşağın gözləri saralıb, kirpikləri quş-quş olub və başının tükü bizbizdi.* "Mol. Nəsr." **Quşu qonmaq** – meyli düşmək, xoşuna gəlmək. *Dəmirçioğlunun müştəriyə quşu qondu.* "Koroğlu".

**QUŞALUSU** *is.* Albuxaraya oxşar bir meyvə.

**QUŞARMUDU** *is.* Xırda cır armud. *Quşarmudunun meyvələri şaxtalar düşdükdən sonra yumşalır və yeyilə biləcək şəkil alır.* Qədirov. *Bu meşənin quşarmudular, sümük-*

*lü əzgilləri hələ dayanıb kal-kal gözlərini döyürdülər.* S.Rəhimov.

**QUŞATAN** *is. dan.* Uşaqların quş vurmaq üçün düzəltdikləri daşatan alət, sapand. *İkinci bir uşaq quşatanla ağaca qonmuş sərçəni nişan aldı.* H.Axundlu.

**QUŞBAXIŞI** *zərf* Ötəri, ani baxış; gözünün ucu ilə baxış. *Quşbaxışı bu adamları müqayisə etdim*. Mir Cəlal.

**QUŞBAŞI** *sif.* İri parçalar şəklində, quş başı böyüklüyündə (yağan qar haqqında). *Parça-parça düşərək quşbaşı* (z.) *göydən yerə qar; Sarılır ağ mitilə boz dərə, çöllər, dağlar*. A.Şaiq. *Qar yağır, quşbaşı qar incə çiçəklər üstə..* S.Rüstəm.

**QUŞBAZ** *is.* [quş və *fars*. ...baz] Quşları, quş saxlamağı sevən adam; göyərçin saxlayan adam. *Bunlar hamısı keçəndən sonra, bu otuz doqquz nömrədə min doqquz yüz doxsan doqquz rəmmal, kimyagər, .. kəndirbaz, quşbaz .. şəkli çəkmişik.* C.Məmmədquluzadə.

**QUŞBAZLIQ** *is.* Quş saxlayan adamın peşəsi, işi. *Mollaxanadan qovulan gündən etibarən uşaq fikrini quşbazlıq və bu kimi işlərə verərdi.* H.Sarabski.

**QUŞBEYİN** *sif. dan.* Ağılsız, dərrakəsiz, gic, beyniboş.

**QUŞBURUN** *sif.* Burnu quş dimdiyi kimi olan. *Bəlkə Müqim bəy pristavlıqdan, polislikdən də əvvəlki köhnə bəy paltarını geyəydi, başında uzun papaq, .. ayağında quşburun çəkmə olduğu halda gedəydi?* S.Rəhimov.

**QUŞCUQ** b a x **quşcuğaz**. *Bir quşcuğun uçuşunda bilsəniz nələr; Nələr duyur bir şairin səyyar ürəyi*. S.Vurğun.

**QUŞCUĞAZ** "Quş"dan *oxş*. *..Yaşıl yarpaqlar arasına sığınmış quşcuğazlar səs-səsə verib ötüşürdü*. A.Şaiq. *Ağabəyim diksinmiş bir quşcuğaz kimi başını cəld qaldırıb, Vaqifin üzünə baxdı*. Çəmənzəminli.

**QUŞÇU** *is.* 1. Quşçuluq mütəxəssisi. // Quşçuluq ferması işçisi, fermada ev quşları bəsləməklə məşğul olan adam.

2. Quş saxlamaqla məşğul olan adam; quşbaz. *Tağı əmi quşçular arasında məşhur idi. O, bəslədiyi quşun önündən bir qırqovul qaçıb canını qurtara bilməzdi*. S.S.Axundov. *Quşçular özləri də xəsillərin dibində gizlənib düdük çalırdılar.* H.Sarabski.

3. Qədimdə: xanların, bəylərin ov quşlarına baxan adam. [Bəy:] *Bunların babaları ya xanın cəlladları olublar, ya təlxək, ya qatırçı, ya quşçu.* Ə.Haqverdiyev.

**QUŞÇULUQ** *is.* Kənd təsərrüfatının bir sahəsi kimi ev quşları yetişdirmə təsərrüfatı. *Quşçuluq mühüm kənd təsərrüfatı sahələrindən biridir.*

**QUŞDİLİ** *is.* 1. *məh. bot*. Tünd-yaşıl rəngli, yeyilən bir bitki.

2. *məc.* Anlaşılmayan bir dil.

**QUŞƏLƏYİ** *is.* Çörəyə naxış salmaq üçün dəstə şəklində bağlanan quş lələkləri topası.

**QUŞƏPPƏYİ** *is. bot.* Otlaqlarda, çəmənlərdə, arx kənarlarında bitən uzun saplaqlı, ağ, xırda çiçəkləri olan, yeyilən birillik ot bitki. *Allahqulu daşların dibindən bir az quşəppəyi qopardı, yedilər, sonra yollarına düzəldilər.* Çəmənzəminli.

**QUŞXANA** *is.* [quş və *fars*. ...xanə] Quşlar, adətən ev quşları yetişdirilən, saxlanılan yer.

**QUŞLAMAQ** *f.* Alıcı quşla ovlamaq. ☐ **Quş quşlamaq** – alıcı quşla quş ovlamaq.

**QUŞNİŞAN** *sif.* Üstündə quş şəklində naxışı olan. *Quşnişan xalça*.

**QUŞQALXMAZ** b a x **quşqonmaz**[1]. *Qara .. elə bil ki, o quyunun dibindən düz birbaş quşqalxmaz dağın başına uçub qalxmışdı.* S.Rəhimov.

**QUŞQONMAYAN** b a x **quşqonmaz**[1]. *Gərək quşqonmayan dağlar çapılsın; Uzaq səhralara yollar tapılsın.* Z.Xəlil.

**QUŞQONMAZ**[1] *sif.* Çox uca, çox yüksək. *Quşqonmaz dağlar. – Quşqonmaz qayalar vermiş baş-başa; Xəyalım az qalıb oynayıb coşa.* S.Vurğun. *..Qəsr-qala .. Terekin sol sahilində quşqonmaz qayaların zirvəsində tikilmişdir.* M.İbrahimov.

**QUŞQONMAZ**[2] *is. bot.* Efir yağlarına malik və tərkibində aşı maddəsi olan nazik gövdəli, sarı tikanlı ot bitki. *Quşqonmaz – çoxillik ot olub, bataqlıq yerlərdə və çay kənarlarında bitir*.

**QUŞQULANMAQ** *f.* Hürkmək, qorxmaq, titrəmək. *Köpək də dərənin dibindən keçən dəvə karvanının zəng səslərini dinləyə-dinləyə quşqulanır.* M.S.Ordubadi.

**QUŞQUN** *is.* Atın belində yəhərin qabaq tərəfə sürüşməməsi üçün onun quyruğu

altından keçirilən qayış. // Ümumiyyətlə, iş heyvanlarının quyruğu altından keçirilən qayış. *Quşqun olub quyruğa keçincə, yüyən olub ağıza keç.* (Ata. sözü). *Birdən ala cöngənin quşqunu quyruğunun dibini sürtdü.* S.Rəhimov.

◊ **Quşqun bağlamaq** – ələ salmaq, lağa qoymaq, araya qoymaq, masqara edib gülmək. **Quşqun təklifi** – ağızucu təklif, qeyri-səmimi təklif, könülsüz təklif.

**QUŞQUNLAMA** "Quşqunlamaq"dan *f.is.*

**QUŞQUNLAMAQ** *f.* Atın quşqununu taxmaq; quşqun keçirmək (heyvana).

**QUŞQUNLANMA** "Quşqunlanmaq"dan *f.is.*

**QUŞQUNLANMAQ** *məch.* Quşqun keçirilmək, quşqunu taxılmaq. *At quşqunlanmışdır.*

**QUŞQUNLATMA** "Quşqunlatmaq"dan *f.is.*

**QUŞQUNLATMAQ** *icb.* Quşqun taxdırmaq. *Atı quşqunlatmaq.*

**QUŞTƏRƏSİ** *is. bot.* Kolların arasında və zibilliklərdə bitən bir bitki.

**QUŞÜRƏK** *sif.* və *is. dan.* Cəsarətsiz, ürəksiz, qorxaq.

**QUŞÜZÜMÜ** *is. bot.* Salxım şəklində bitən, qırmızı giləli kol bitkisi.

**QUTAB** *is.* İçərisinə döyülmüş ya ət, ya göyərti, ya qabaq və s. qoyularaq yağda qızardılan yarımdairə şəkilli xəmir bişmişi. *Ət qutabı. Tərə qutabı. Qabaq qutabı. – Aşü plovdan oluruq kamyab; Yağlı fətirlər yeyirik, həm qutab.* S.Ə.Şirvani. *Güldanə boşqabdan iki qutab götürüb yedi.* Ə.Vəliyev.

**QUTAN, QUTANQUŞU** *is. zool.* Uzun və nazik boğazlı, gödək qıçlı, uzun dimdikli, ayaqları enli və pərdəli quş. *Gərdəni ağ, boynu misali-qutan; Bir nəfəsə sərçəni yüz min tutan.* S.Ə.Şirvani.

**QUTLU** *sif.* və *zərf qəd.* Uğurlu, səadətli, xoşbəxtlik gətirən. *Başıma qutlu ayağın gəldi basdı ol nigar; Kölgəsi düşdü bana sərvi-xuramanın yenə.* Nəsimi.

**QUTTAPÉRÇA** [*ing.* əsli *mal.*] Bəzi bitkilərin bərkləşmiş şirəsindən alınan dəriyə oxşar plastik kütlə. *..Adigərməşovun gövdə qabığında, kökündə və yarpaqlarında qutta-perça maddəsi çoxdur.* M.Qasımov.

**QUTU** *is.* İçinə şey qoymaq üçün taxtadan, kartondan, metaldan, plastmasdan və s.-dən qayrılan qab. *Tütün qutusu. Konfet qutusu. Qəhvə qutusu. Kibrit qutusu.*

◊ **Kəllə qutusu** *anat.* – b a x **kəllə**.

**QUTUCUQ** *is.* Balaca qutu.

**QUTULU** *sif.* Qutusu olan.

**QUVARLANMA** "Quvarlanmaq"dan *f.is.*

**QUVARLANMAQ** *f. məh.* Ürəklənmək, fərəhlənmək. *Bəxtiyar tüfənglə vermədən ara: – Ya mən ölməliyəm, ya siz! – deyirdi; Cəlal quvarlanıb nəşə yeyirdi.* S.Vurğun.

**QUYLAMA** "Quylamaq"dan *f.is.*

**QUYLAMAQ** *f.* 1. B a x **quyulamaq**. *Öləni quylamışıq, öldürəni danlamışıq..* Ə.Nəzmi.

2. Qoymaq, soxmaq. *Sona dizlərini ota quylamışdı.* Mir Cəlal.

**QUYLANMA** "Quylanmaq"dan *f.is.*

**QUYLANMAQ** *f.* Girmək, batmaq. *Ey tirmə rəxti-xab içinə quylanan dadaş! Getsə vətən, vətənlə gedər istirahətin.* M.Möcüz. *Körpü elə tikilməli idi ki, maşınlar onun üzərindən keçərkən təkərlərin yarısı suya quylansın.* Ə.Sadıq.

**QUYMAQ** *is.* Yağda bişirilərək bal və ya şəkərlə yeyilən xəmir xörəyi. *Quymaq undan bişirilən qatı sıyıqdır. – Əriştə bəylər aşı; Quymaq onun yoldaşı.* (Ata. sözü). *Balaca nəvəsinin eşqi ilə çırpınan Sərvinaz arvad, quymaq çalanlara göz yetirir, sonra da uşağın təhər-töhürünə baxırdı.* M.Hüseyn.

**QUYRUQ** *is.* 1. Heyvanların çoxunun bədənlərinin qurtaracağındakı mütəhərrik törəmə, yaxud heyvanın bədəninin getdikcə nazikləşən dal hissəsi. *At quyruğu. Əqrəb quyruğu. Balıq quyruğu. – Bir həyətdə on iki-on üç yaşında bir .. uşaq pişiyin quyruğuna ip bağlayıb, həyətin o tərəfinə qaçırdı.* C.Məmmədquluzadə. // Qoyunların bədənlərinin qurtaracağındakı ət halında olan yağ kütləsi. *Qoyun quyruğu. Qoç quyruğu.* □ **Quyruq yağı** – qoyun quyruğunun əridilməsindən çıxan yağ. // Quşların bədənlərinin qurtaracağındakı uzun və ya qısa lələk topası. *Xoruz quyruğu. Qırqovul quyruğu. Tovuz quyruğu.*

2. Uçucu aparatların dal hissəsi. *Təyyarənin quyruğu.*

3. Hərəkət edən (yeriyən) bir şeyin axırıncı, ən arxadakı hissəsi. *Qatarın quyruğu. Sürünün quyruğu göründü. Dəstənin quyruğu.*

// *məc.* Axır, axırıncı. [Qurban:] *Namərdlər, alçaqlar, nə qədər ki, quyu dərinləşməmişdi, mən baş idim, onlar quyruq*. A.Şaiq. // Ümumiyyətlə, bir şeyin qurtaracağı, son hissəsi.

4. *dan*. Növbədə durmuş adamlar sırası.

5. *məc.* Bir adamın arxasına düşüb ondan ayrılmayan adam haqqında; əlaltı. □ **Quyruq olmaq** – daim birinin dalına düşüb, ondan əl çəkməmək. // *məc. dan*. Bir adamın dalınca, ya yanınca gələn adam.

◊ **Quyruğu qapı arasında qalmaq** – bilmədən girə düşmək, işi dara düşmək, çətin və çıxılmaz bir vəziyyətdə qalmaq, nə edəcəyini bilməmək. **Quyruğu qapı arasından çıxmaq** – girdən qurtarmaq, çətin və çıxılmaz vəziyyətdən qurtarmaq, daha başqasından asılı olmamaq. *Quyruğun qapı arasından çıxıb, daha bizi saymazsan.* M.Hüseyn. **Quyruğu paçada olmaq** – çəkinmək, qorxa-qorxa dolanmaq; qəribliyə düşərək qısınmaq. **Quyruğu tələdə qalmaq** – b a x **quyruğu qapı arasında qalmaq**. **Quyruğu tələdən çıxmaq** – b a x **quyruğu qapı arasından çıxmaq**. **Quyruğunu basmaq** – bir hərəkətlə, ya sözlə birinə toxunmaq, sataşmaq. **Quyruğunu belinin tirinə qoymaq** – lovğalanmaq, təşəxxüs satmaq, etina etməmək, saymamaq, meydan oxumaq, istədiyini etmək. **Quyruğunu düyünləmək** – möhkəm durmaq, hər bir ehtimala qarşı hazır olmaq, hazır durmaq. **Quyruğunu eşmək** – 1) qaçmağa hazırlanmaq; 2) b a x **quyruğunu belinin tirinə qoymaq**. **Quyruğunu əldən buraxmaq (vermək)** – əldən çıxarmaq (ələ keçmiş şeyi). **Quyruğunu tapdalamaq** – acışdırmaq məqsədi ilə sözlə və ya hərəkətlə birinə dolaşmaq, sataşmaq, öcəşmək. **Quyruğunu tutmaq** – 1) birdən ələ keçirmək, girinə keçirmək; 2) ardına düşmək, təqib etmək, izləmək. **Quyruq bulamaq** – 1) yaltaqlanmaq, yaltaqlıq etmək. [İsmayıl] *molla olsa da çox nadürüst bəndədir. Srağagünəcən bizim kənddə quyruq bulayırdı*. P.Makulu; 2) yaltaqlıqla və s. yollarla tədbir görmək, iş görmək, aralığa girmək. [Ağa Mərdan:] *İndi durum gedim, məhkəmədə olan haşiyənişinləri püxtə və amadə edim ki, sabah mürafiə vaxtında bəqədri-lüzum quyruq bulasınlar*. M.F.Axundzadə. **Quyruq doğmaq (**əsli: **quyruq donmaq)** – yay fəslinin yarıdan keçdiyini bildirən ifadədir. *İki ay, artıqbaşı iki ay yarımdan ziyadə dağda qalmayıb, quyruq doğandan sonra, yəni iyulun iyirmi beşindən, yainki avqustun əvvəllərindən başlayırlar arana köçməyə*. F.Köçərli. *Köçəri dili ilə deyilsə, "quyruq doğub" havalar sınandan sonra, bu yaylaqların adamları bir-bir yerindən tərpənər, .. köç üzüaşağı enərdi*. S.Rəhimov. *Əntiqə yazbaşı yox, yayın axırlarında, "quyruq doğandan" sonra gəlmişdi*. Mir Cəlal. **Quyruq ələ verməmək** – aradan sovuşub çıxmaq, ələ keçməmək, tutulmaq qorxusundan hiylə və kələklə yaxasını qurtarmaq. **Quyruq qısmaq** – qorxub özünü yığışdırmaq, yaxud qaçmaq, əkilmək. ..*Qalan iki-üç atlı isə aslan görmüş çaqqallar kimi, quyruqlarını qısaraq qaçdılar.* M.Rzaquluzadə. **Quyruqda bıçağı sındırmaq** – bir işi görüb tamamlamamaq, yarımçıq qoymaq, axıra çatdırmamaq. **Quyruqda qalmaq** – yubanmaq, geriyə düşmək, hamıdan geri qalmaq, bir işdə axırıncı yeri tutmaq. **Quyruqda sürünmək** – 1) b a x **quyruqda qalmaq**; 2) öz fikri olmayıb başqalarının fikri ilə oturub-durmaq.

**QUYRUQALTI** 1. *is.* İş heyvanlarının quyruqlarının altından keçirilən örkən və onun qalın dəridən və ya keçədən tikilmiş quyruq altından keçirilən orta hissəsi; paldüm.

2. *sif.* Quyruğun altında olan, quyruğun altında yerləşən. *Xanı balığında quyruq üzgəcindən əlavə iki bel üzgəci və bir quyruqaltı üzgəci olur.* "Zoologiya".

**QUYRUQBULAYAN** *sif.* və *is. dan*. 1. Yaltaq.

2. İt. [Tarverdi axunda dedi:] *Məhərrəmin on beşindən sonra bu kənddə bir quyruqbulayan tapa bilməzsən*. Qantəmir.

**QUYRUQCUQ** *is.* 1. Kiçik quyruq, qısa quyruq, incə quyruq.

2. Bir şeyin quyruğa oxşar ucu, kənarı, çıxan hissəsi.

**QUYRUQLAMA** *dan.* "Quyruqlamaq"-dan *f.is.*

**QUYRUQLAMAQ** *f.* 1. Quyruğundan tutmaq, quyruğundan yapışmaq. *İti quyruqlamaq. Camışı quyruqlamaq. Noxtasını qırmış atı quyruqladılar.*

2. *məc. dan.* Tutmaq, ələ keçirmək, yaxalamaq, tutub buraxmamaq.

**QUYRUQLANMA** "Quyruqlanmaq"dan *f.is.*

**QUYRUQLANMAQ** *məch.* 1. Quyruğundan tutulmaq.

2. *məc. dan.* Tutulmaq, ələ keçirilmək, yaxalanmaq; girə düşmək.

**QUYRUQLU** *sif.* 1. Quyruğu olan. *Quyruqlu at. Quyruqlu qoç. Quyruqlu heyvanlar.*

2. *məc.* Arxasında quyruq kimi sallanan hissəsi, parçası və s. olan. *Quyruqlu paltar.*

◊ **Quyruqlu ulduz** *köhn.* – b a x **kometa**. *Deyirdilər ki, bu gün, yəni ayın 17-də bir quyruqlu ulduz yerə toqquşacaq və istisinin hərarətindən Yer üzünün məxluqatı tələf olacaq.* "Mol. Nəsr."

**QUYRUQSUZ** 1. *sif.* Quyruğu olmayan, quyruğu kəsik; lümək. *Quyruqsuz inək. Quyruqsuz tula. Quyruqsuz xoruz. Quyruqsuz kərtənkələ.*

2. *is.* Cəm şəklində: **quyruqsuzlar** *zool.* – böyüdükdə öz quyruğunu itirən suda-quruda yaşayan heyvanlar dəstəsi. *Su və quru qurbağaları suda-quruda yaşayanların quyruqsuzlar qrupuna aiddirlər.* "Zoologiya".

**QUYU** *is.* Su, neft, qaz çıxarmaq və s. məqsədlər üçün silindr şəklində qazılmış dərin və ya dayaz çuxur. *Su quyusu. Neft quyusu. – Özgəyə quyu qazan özü düşər.* (Ata. sözü). *Tülkü gəzəndə yıxılıb nagahan; Bir quyuya düşmüş idi bir zaman.* A.Səhhət. *Nə olsun? Ay fağır kişi! O quyudan burayadək lağım vurmuşam.* Ə.Haqverdiyev.

◊ **Quyu qazımaq** *məc.* – birinin yamanlığına, bədbəxtliyinə çalışmaq, ayağından çəkmək, əlaltından əleyhinə iş görmək. [Vəzir:] *Bu arvad xainlik ilə bunu sevgiyə həml edib, biçarəyə quyu qazır.* M.F.Axundzadə. *Lakin bir çoxları vardır ki, hal-hazırda bizə .. quyu qazırlar.* M.S.Ordubadi.

**QUYUÇU** *is.* Əl ilə quyu qazan adam; kankan.

**QUYUQAZAN, QUYUQAZIYAN** *is.* 1. Quyu qazımaq ilə məşğul olan adam; kankan. [Köhnə] *Bakıda ümumiyyətlə peşəkarlar: bənna, xarrat, dəmirçi, quyuqazıyan .. və sairə çox olardı.* H.Sarabski. // Sif. mənasında. *Quyuqazan maşın.*

2. *məc.* Başqasının ayağının altını qazan, onun pisliyinə, bədbəxtliyinə çalışan adam.

**QUYULAMA** "Quyulamaq"dan *f.is.*

**QUYULAMAQ** *f.* Basdırmaq, quyu kimi bir yerə qoyub üstünü torpaqla örtmək, torpağın altında gizlətmək, yerə gömmək. *O pullar ki Zeynəbin ixtiyarında idi, bəzisini Zeynəb yerə quyulayıb gizlətmişdi, bəzisi özgədə idi.* C.Məmmədquluzadə.

**QUYULANMA** "Quyulanmaq"dan *f.is.*

**QUYULANMAQ** *məch.* Basdırılmaq, torpaq altında gizlədilmək.

**QUYULATMA** "Quyulatmaq"dan *f.is.*

**QUYULATMAQ** *icb.* Quyulama işi gördürmək.

**QUZAPAYI** *is.* Pambıq yığıldıqdan sonra tarlada qalan pambıq bitkisi qalıqları. *Qozalar yığıldıqdan sonra quzapayı çıxaran maşınlar tarlaya buraxılır.*

**QUZEY** *is.* 1. Dağın, evin və s.-nin gün düşməyən, günəş görməyən yeri; həmişə kölgəli yer (*güney* ziddi). *İgidlər könlünə şikvə gətirmək; Necə dağdır quzeyində qar olmaz.* Qurbani. *Əriyir yaz günü quzeydəki qar; Gəzir dağ döşünü gəlinlər, qızlar.* S.Vurğun. *Yay, qış qoynu qarlı olan quzey dərələrin sərinliyini hiss edir.* O.Sarıvəlli.

2. Şimal mənasında. [Əhməd:] ..*Gərək o adamın dədəsinə od vurasan və elə vurasan ki, heç bilməsin ki, bəla güneydən gəldi, ya quzeydən..* N.Vəzirov.

**QUZĞUN** *is.* 1. *zool.* Qarğa növündən iri və bərk şığıyan yırtıcı quş. *Quzğun nəştər qaynaqlı, əyri dimdikli, leş didən bir quşdur.* N.Vəzirov. *Mən quşların adlarını bilməzdim. Çalağan ilə quzğuna fərq qoymazdım. Onları mənə öyrədən Tağı əmi oldu.* S.S.Axundov. *Ana .. bir dərənin üzərində qarğaların, quzğunların halay vurub hərləndiyini gördü.* M.Rzaquluzadə.

2. *məc.* 1941-1945-ci illər müharibəsi vaxtı faşist təyyarələrinə verilən ad. ..*Quzğunların qanadını bir vuruşda yerə salın!* S.Vurğun.

**QUZU** *is.* 1. Qoyun balası. *Quzu əti. Quzu dərisi. – Mal qapıya gələndə axşam-səhər; Qoyun mələr, quzu mələr, dağ mələr.* A.Şaiq. *Çıxır dağ döşünə körpə quzular; Tarlanın səsini əks edir sular.* S.Vurğun.

2. *məc.* Çox yumşaq, sakit, həlim adam haqqında. *O, quzu kimi adamdır.* ☐ **Körpə quzu** *məc.* – məsum, təcrübəsiz, ana uşağı. [Uruz] *arabir at minib ox süzdürsə də, .. ananın nəzərində hələ körpə bir quzu idi.* M.Rzaquluzadə. // "**Quzum**" şəklində – əzizləmə, oxşama; nəvazişlə, mehribanlıqla müraciət. *Yavrum, quzum, bahari-həyatın nə cür olar?* A.Səhhət. *Ürəyi şad, könlü açıq; Körpə quzum, ağ günə çıx!* S.Vurğun.

**QUZUCUQ** "Quzu"dan *oxş.* və *kiç.*

**QUZUÇU** *is. k.t.* Quzulara baxan, quzu otaran balaca çoban. *Gənc quzuçu daha ayıq gözlə indi ..* [quzuların] *dövrəsində gəzir və Mayagilə tərəf baxırdı.* M.İbrahimov. *Atalar məsəlidir:* "*Naxırçı ilə quzuçunun haqqını kəsdin, gərək kənddən çıxasan*". "Qaçaq Nəbi".

**QUZUDİŞİ** *is.* Uşaqlarda ilk çıxan və yeddi yaşlarında dəyişən diş.

**QUZUQULAĞI** *is. bot.* Dadı turş və uzunsov yarpaqları olan, yeyilən tərəvəz bitkisi; turşəng. *Yamacdan körpə yarpız, quzuqulağı yığıb döşlüklərinə toplayırdılar.* Ə.Vəliyev.

**QUZULAMA** "Quzulamaq[1]"dan *f.is.*

**QUZULAMAQ[1]** *f.* Quzu doğmaq, balalamaq (qoyun haqqında). *Bu gecə ağılda iki qoyun quzulamışdı. – Quzuladı qoyun, töküldü döllər; Yaylaq həvəsini qıldı ellər.* Xətayi.

**QUZULAMAQ[2]** *f. məh.* Yumşalıb narınlaşmaq, ovulub tökülmək, boşalmaq, yaxud horra halına gəlmək (torpaq haqqında). *Bir tərəfi quzulayıb ot saçaqları sallanan bir təpədə iri qol-qanadı qurumuş bir ağac vardı.* Çəmənzəminli. *Tikanlı tel uzanır, hər yana əyri, qıyğac; Palçıq çıxır qurşağa, quzulamış səngərdə.* R.Rza.

**QUZULU** *sif.* Yanında quzusu olan, balasını əmizdirən. *Quzulu qoyun.*

**QUZULUQ** *is.* 1. Quzu saxlanan yer, quzu yatağı.

2. *məc.* Həlimlik, yumşaqlıq, sakitlik.

**QUZUOTARAN** *is.* Quzuları otaran çoban.

**QÜBAR** b a x **qubar** (şeirdə çox vaxt tərkiblərdə məcazi mənada işlənir). *Mən gülşəni-can içində xarəm; Ayineyi-əqlə bir qübarəm.* Füzuli. *Sevindilər, azca keçmədi yenə; Qondu qəm qübarı sifətlərinə.* M.Rahim.

**QÜBBƏ** *is.* [*ər.*] 1. Yarımkürə şəklində dam; günbəz. *Eyvanın tavanı üç böyük qübbədən ibarət idi ki, bunların hər birisi beş sütun üzərində qurulmuşdu.* M.S.Ordubadi.

2. Qübbəyə oxşar hər hansı bir şey. *Səba xanım kamançanı götürüb başındakı sədəf qübbəni çıxardı.* M.S.Ordubadi.

◊ **Göy qübbəsi** – gözlə görünən göy; səma. *Göy qübbəsindən asıldı qəndil; Üzündən alıb niqabü məndil.* Xətayi. [Dərviş:] *Göyün qübbəsi tavanım, qara torpaq – arxam idi.* A.Divanbəyoğlu. *..Bir azdan sonra göy qübbəsi tamamilə ulduzla doldu.* Ə.Sadıq.

**QÜBBƏLİ** *sif.* Damı, səqfi yarımkürə (qübbə) şəklində olan; qübbəsi olan. *Qübbəli bina. – ..Turşsu çeşməsinin başında qırmızı qübbəli ağ çadır dayanmışdı.* S.Rəhimov.

**QÜBBƏŞƏKİLLİ** *sif.* 1. Qübbəyə oxşar, yarımkürə şəklində olan.

2. Üzərində qübbə şəkilli örtüsü və s. olan.

**QÜBBƏVARİ** b a x **qübbəşəkilli**.

**QÜDDƏ** [*ər.*] b a x **vəzi**.

**QÜDDƏLİ** *sif. anat.* Qüddəsi olan, vəzisi olan.

**QÜDRƏT** *is.* [*ər.*] 1. Böyük qüvvət, güc. *Vətənimizin hərbi və iqtisadi qüdrəti gündən-günə artır.* // Ümumiyyətlə, güc, iqtidar, qüvvət, bacarıq. *Yorulmaq bilməmiş əqlin qanadı; Gör insan əqlinin nə qüdrəti var.* S.Vurğun. *Can usta, axı mənim böyük bir niyyətim var; Mənim həyat qurmağa qəlbim var, qüdrətim var.* M.Müşfiq. *Bu ellər ən çətin dəqiqələrdə; Güvəndi, inandı öz qüdrətinə.* O.Sarıvəlli.

2. Təsir qüvvəsi, böyük nüfuz qüvvəsi. [Nizami:] *Gəncənin ən böyük şeir ustadı Məhsəti xanım sənətin qüdrətini Munisə göstərir.* M.Hüseyn. *Təbindəki, dühasındakı nəhəng qüdrəti ilə zülmə, haqsızlığa üsyan edən şairin səsi boğulmuşdu.* Mir Cəlal.

3. Taqət, iqtidar, güc. *Qüdrətim olmadı ki, danışam.*

4. Möhkəmlik, iradə, iradə qüvvəsi. [Solmaz:] *Ancaq unutma ki, mən ərlərdə qüvvət, qüdrət və cəsarəti sevirəm.* C.Cabbarlı. *O, insanın böyüklüyünü və ruhi qüdrətini kəşf etdiyi üçün, artıq ağır yaralılar qarşısında çarəsiz bir uşaq kimi ağlamaqla kifayətlənməzdi.* Ə.Məmmədxanlı. // Cəsarət. *Axır nə səbəbə söz deməyə qüdrətin olsun?* M.Ə.Sabir.

5. Təbiət, fitrət, yaradılış. *Zülhəyat oldı ləbindən Xizrivü İsa layəmut; Gör bu qüdrət*

*möcüzi kim, ləli-sirabındədir.* Nəsimi. *Söz yox ki, hüsnünə xilqət günündə; Qüdrət qələm çalmış, susmuş mələklər.* Ə.Cavad. // Çıx. halında: **qüdrətdən** – təbiətdən, fitrətdən, yaradılışdan. *Qaşın bir nundur çəkmiş qəza nəqqaşı qüdrətdən.* M.V.Vidadi.

**QÜDRƏTLƏNMƏK** *f.* Çox güclənmək, çox qüvvətlənmək.

**QÜDRƏTLİ** *sif.* Çox qüvvətli, çox güclü. *Qüdrətli əllər. Qüdrətli ordu.*

**QÜDRƏTLİLİK** *is.* Qüdrət sahibi olma; çox qüvvətlilik, güclülük; iqtidar.

**QÜDRƏTSİZ** *sif.* İqtidarsız, gücsüz; zəif, aciz, bacarıqsız. *Hacı əfəndi .. hətta məclis üzvlərinin ikisini də qüdrətsiz və cahil mollalardan təyin elətdirib ki, sirlərini və politikasını açmasınlar və ona qul kimi tabe olsunlar.* C.Məmmədquluzadə.

**QÜDRƏTSİZLİK** *is.* İqtidarsızlıq, gücsüzlük, taqətsizlik, qüvvətsizlik; acizlik, zəiflik, bacarıqsızlıq.

**QÜDSİLİK** bax **qüdsiyyət**. *Qulam müəllim yaşaran gözlərini təsəvvürünə gətirir, burada bir ülvilik və qüdsilik görürdü.* S.Rəhimov.

**QÜDSİYYƏT** *is.* [*ər.*] *tənt.* Müqəddəslik, təmizlik, paklıq. [Yanardağ:] *Cavab ver, odlar gəlini! Axır, bütün ümid sənin qüdsiyyətindədir.* C.Cabbarlı. *Uğur olsun, Ədhəm, düşmənin puç olsun!. ..Vətən torpağının qüdsiyyəti sənə kömək olsun!* Mir Cəlal. *Elə bil ki, o təbəssümdə dünyanın bütün gözəllik və qüdsiyyəti gizlənmişdi.* İ.Əfəndiyev.

**QÜLĞÜLƏ** *is.* [*fars.*] *klas.* Gurultu, çaxnaşma, səs-küy, mərəkə. A*faqə düşdü qülğülə hüsnündən, ey qəmər!* Nəsimi. ☐ **Qülğülə salmaq** – səs salmaq. *Ənva və əqsam quşlar ağacların bir budağından o biri budağına qalxıb, qonub, mövzun nəğəmat ilə dərəyə qülğülə salırlar.* M.F.Axundzadə.

**QÜLLƏ** *is.* [*ər.*] 1. Sütunşəkilli uca tikili, bina və s. *Qüllənin zəngi vurdu. Paraşüt qülləsi. Televiziya qülləsi. Yanğın qülləsi. – ..Qüllələr günəşin şüaları altında qızıl taclar kimi parıldayır.* M.Hüseyn.

2. Hərb gəmisində, tankda və s.-də topların yerləşdiyi zirehlənmiş hündür yer.

**QÜLLƏLİ** *sif.* Qülləsi olan. *Qülləli ev.*

**QÜLLƏVARİ** *sif.* Qüllə kimi, qülləyə oxşar, qüllə şəklində. *Qülləvari bina.*

**QÜMQÜMƏ** [*ər.*] bax **qumquma** 1-ci mənada.

**QÜNNƏ** *is.* [*ər.*] *dilç. köhn.* Burun səsi, burunda tələffüz olunan səs.

**QÜRAB** *is.* [*ər.*] Qaraqarğa (klassik şeirdə gözəllərin qara saçı buna təşbeh edilirdi). *Xalın üzündə buğda, başında saçın qürab.* M.Ə.Sabir.

**QÜRBƏT** *is.* [*ər.*] 1. Yad ölkədə, yad yerdə olma, vətənindən uzaq ölkədə və ya yerdə olma; qəriblik. *Qürbət aləmi, yar fəraqi məni aldı...* Heyran xanım. *Qürbətin acılıqları hər vaxtdan artıq gecələr hiss olunur.* M.S.Ordubadi. *Onun qürbətdən şikayətə öyrənmiş dodaqları arasında xırdaca sədəf dişləri görünürdü.* M.Hüseyn.

2. Özgə yer, vətəndən uzaq yer, yad ölkə. *Kərbəlayı Məhəmmədəli iki il yarımdır ki, qürbətə çıxıb, az-çox çörək pulu qazansın.* C.Məmmədquluzadə. [Şahnisə xanım:] *..Kiçikbəyim kimi bir gülü götürüb Tehrana atıram. Kim bilir .. qürbətdə qızım necə olacaq, başına nələr gələcək.* Çəmənzəminli.

3. *sif.* Vətəndən uzaq, yad, özgə, yabançı. *Müddətdi düşmüşəm qürbət diyarə; Kimsədən olmadı dərdimə çarə.* Q.Zakir. *Əcəba, səndəmi məni qürbət vilayətdə tək buraxıb getmək istəyirsən?* M.S.Ordubadi. *Qürbət bir şəhərin bazarında iki adam qabaq-qabağa gəlib bir-birinə zənn ilə baxdılar.* Çəmənzəminli.

**QÜRBƏTÇİ** *is.* Qürbətdə yaşayan adam, özgə yerlərdə, öz vətəni xaricində yaşayan adam.

**QÜRBƏTKEŞ** *sif.* [*ər.* qürbət və *fars.* ...keş] Qürbət çəkən, ömrünü qürbətdə keçirən. *Təbriz müsəlmanlarının çoxu belədir.. Qürbətkeş olurlar. Ta ki, pul qazanmaq olsun.* P.Makulu.

**QÜRBƏTLİK** bax **qürbət** 1-ci mənada. *Ey mənim tək göz yaşını saçanlar; Qürbətlikdə ciyər qanın içənlər.* M.V.Vidadi. *Sonra* [Məmməd Həsən əmi] *bir qızla sevişdi, haman qızı aldı və bir neçə il gedib İrəvan tərəflərində qürbətlik çəkdi.* C.Məmmədquluzadə.

**QÜRBƏTZƏDƏ** *sif.* və *is.* [*ər.* qürbət və *fars.* ...zədə] Qürbətə düşmüş, vətənindən uzaq düşmüş, qürbət keçirən; qəriblikdən yorulmuş, usanmış.

**QÜRƏ** *is.* [*ər.*] Püşk. [Cəmaləddin:] *Artıq təxir zamanı deyil, qardaşlar, qətli icra etmək üçün fədai təyin olunacaq. Onun üçün qürə atılmalıdır.* C.Cabbarlı.

**QÜRRƏ** [*ər.*] bax **qürrəli**. *Nə qürrəsən bu vəfasız həyata, ey xacə; Nihayət oldu bu şəb, ömrdür çirağі-səbah.* S.Ə.Şirvani.

**QÜRRƏLƏNMƏ** "Qürrələnmək"dən *f.is.*

**QÜRRƏLƏNMƏK** *f.* Əsassız və boş bir şeyə arxalanaraq qürurlanmaq, güvənmək; iftixar etmək, lovğalanmaq. *Boş yerə qürrələnməkdən nə çıxar? – Bu sözü elə övrət ağzına alıb danışar ki, ya atasına ümidi gələ, ya anasına, .. ya ki, öz dövləti və puluna qürrələnə.* C.Məmmədquluzadə. *Çox güvənmə, qürrələnmə haluva, övladuva.* M.Möcüz.

**QÜRRƏLİ** *sif.* Məğrur, kibrli, iddialı, təşəxxüs satan, lovğa. *Qürrəli adam.*

**QÜRUB** *is.* [*ər.*] Batma, üfüqün altına keçib görünməz hala gəlmə. *Günəşin qürubu. Qürub vaxtı. – Günəş qürubunun qırmızı buludları günbatan tərəfi .. bürümüşdü.* C.Məmmədquluzadə. *Uçan durna, sönən qürub nağılları andırır.* Ə.Cəmil. // Günbatan vaxt. *Müşavirə qürubdan bir-iki saat keçənə qədər davam etdi.* Çəmənzəminli. ☐ **Qürub etmək** – 1) batmaq. *Bu vaxt gün qürub etdi.* M.F.Axundzadə. *Gün qürub etməyə edirdi şitab; Kainata enirdi bir zülmət.* C.Cabbarlı. *Bir axşam günəş qürub edirkən yenə meşədən o səs yüksəldi.* Ə.Məmmədxanlı; 2) *məc.* yox olmaq, zail olmaq. *Qurtardı nisfi-şamdə, saqi, şərabımız; Etdi qürub, heyf, bizim afitabımız.* S.Ə.Şirvani. // Günbatan tərəf, qərb. *Günəş ətəklərini yavaş-yavaş qüruba doğru çəkməyə başlamışdı.* A.Şaiq. *Məxmər kimi yumşaq alaqaranlıq içində əlindəki kətmənə dirsəklənərək, üzü qüruba dayanıb gülümsəyən o gənc qadının çöhrəsində bir bahar təranəsi duyulurdu.* İ.Əfəndiyev.

**QÜRUR** *is.* [*ər.*] 1. İftixar, mənlik hissi, təmkin. *Yenilməz qüvvətlə vur zərbəni, vur! Gözlərində təmkin, alnında qürur.* R.Rza. *Nəriman qürurunu pozmadan ağ və soyuq divara daha bərk söykəndi.* Mir Cəlal. *Bu sevinc əslində bir qürur hissindən ibarət idi.* Ə.Məmmədxanlı. *Ananın şəfqət və qürurla* (z.) *parlayan gözlərində sanki şimşəklər çaxdı.* M.Rzaquluzadə.

2. Təkəbbür, məğrurluq, lovğalıq, özünü yuxarı tutma. *Aldanma zahidə, sanki uludur; Qəlbi kibrü qürur ilə doludur.* A.Şaiq. [Firidun:] *Mən hələ heç bir qürur göstərməmişəm.* M.İbrahimov.

**QÜRURLANMA** "Qürurlanmaq"dan *f.is.*

**QÜRURLANMAQ** *f.* Boş-boşuna qürrələnmək, iddialanmaq, təşəxxüs satmaq.

**QÜRURLU** *sif.* 1. Məğrur, öz mənliyini, cəmiyyətdə öz rolunu, üstünlüyünü hiss edən. *O, öz zindanını uçurtmuş bir məhbus, ölkəsini xilas etmək üçün ölümə gedən bir əsgər kimi qürurlu idi.* M.İbrahimov. // *məc.* Əzəmətli, möhtəşəm.

2. Təkəbbürlü, iddialı, kibrli, təşəxxüslü, başqalarına alçaq nəzərlə baxan.

**QÜSL** *is.* [*ər.*] *din.* Çimmə, yuyunma. ☐ **Qüsl etmək** – çimmək, yuyunmaq. *Bir çeşmə yana olub rəvanə; Qüsli-bədən eylərəm bəhanə.* Füzuli. *Mən eşitmişəm, sizin hamamlarda qüsl üçün hovuz yoxdur.* Ə.Haqverdiyev.

◊ **Qüsl suyu** *köhn.* – murdar, natəmiz iyrənc şey haqqında.

**QÜSSƏ** *is.* [*ər.*] Qəm, kədər, hüzn, ürək sıxıntısı, fikir, dərd. [Hacı Qara:] *Durum gedim evə, tədarükümü görüm, .. yoxsa qüssədən dərdəcər ollam!* M.F.Axundzadə. *İzzət qüssədən və Məhəmməd Həsən əmi hirsindən başladılar Əhməd kimi ağlamağa.* C.Məmmədquluzadə. *Atamız yol gözləməkdən gözdən oldu, anamız qəmdən, qüssədən yatağa düşdü.* M.Rzaquluzadə. ☐ **Qüssə yemək (çəkmək, etmək)** – qəm çəkmək, dərdlənmək, kədərlənmək, bir şeyin fikrini çəkmək.

**QÜSSƏLƏNDİRİLMƏ** "Qüssələndirilmək"dən *f.is.*

**QÜSSƏLƏNDİRİLMƏK** *məch.* Kədərləndirilmək; kədər, qəm-qüssə verilmək.

**QÜSSƏLƏNDİRMƏ** "Qüssələndirmək"dən *f.is.*

**QÜSSƏLƏNDİRMƏK** *f.* Kədərləndirmək, qəmləndirmək, dərdləndirmək; dərd vermək; kədərlənməsinə, qəmlənməsinə, dərdlənməsinə səbəb olmaq.

**QÜSSƏLƏNMƏ** "Qüssələnmək"dən *f.is.*

**QÜSSƏLƏNMƏK** *f.* Kədərlənmək, qəmlənmək, dərdlənmək, fikir çəkmək. *Tamam*

*mənə yanaşıb dedi: – Heç qüssələnmə, doqquz aydan sonra yenə gələcəksən, burada şad görüşəcəyik.* S.S.Axundov.

**QÜSSƏLİ** *sif.* Kədərli, qəmli, məhzun, həzin; dərdli. *Xeyli uzaqdan qüssəli bir mahnı səsi gəlirdi.* M.Hüseyn. *Bu il solğun və qüssəli bir gəlini andıran payızdan sonra .. şiddətli bir qış gəldi.* Ə.Məmmədxanlı.

**QÜSSƏLİLİK** *is.* Qüssəli və kədərli hal; qəmlilik, kədərlilik, məhzunluq.

**QÜSSƏSİZ** *sif.* Qayğısız, dərdsiz, qəmsiz, kədərsiz; dərdi, qəmi, fikri olmayan.

**QÜSSƏSİZLİK** *is.* Qayğısızlıq, dərdsizlik, kədərsizlik, qəmsizlik.

**QÜSUR** *is.* [*ər.*] 1. Eyib, nöqsan, çatışmayan cəhət, çatışmazlıq. *Xoş gəlibdir, xoş saatda cahana; Yox gözəlliyinə qüsur, bahana.* Aşıq Ələsgər. [Əsəd] *bütün işlərin hazır olduğunu və bir qüsur qalmadığını xəbər verdi.* M.S.Ordubadi. *Bu şagirdin geyimi o qədər səliqəli idi ki, ən diqqətli göz belə onda bir qüsur tapa bilməzdi.* Ə.Sadıq.

2. Təqsir, günah, qəbahət. *Gər sən idrak eyləməzsən, bil ki, səndəndir qüsur.* Nəsimi. ..“*Tazə həyat*”*dan təvəqqe edirik ki, əgər qüsurumuz olsa, bizi bağışlasın, .. biz bir az xamıq və o cür yazmağı bacarmırıq ki, bir para adam bizdən inciməsin.* C.Məmmədquluzadə. [Müəllim:] *Sizinlə .. bu vaxta qədər tanış olmadığıma təəssüf edirəm. Bu qüsur mənimmi ya sizinmi?* A.Şaiq.

**QÜSURLU** *sif.* 1. Bir eybi, nöqsanı, qüsuru, çatışmazlığı olan; eyibli, nöqsanlı. *Qüsurlu mal.* // Bitməmiş, natamam, yarımçıq. *Bu evin qapı və pəncərəsi yoxdur, qüsurludur.*

2. Təqsirli, günahlı, qəbahətli. *Mən ki özümü belə bir işdə qüsurlu bilmirəm.* M.İbrahimov.

**QÜSURLULUQ** *is.* 1. Qüsuru, nöqsanı, eybi, təqsiri, günahı, qəbahəti olma.

2. Qüsurlu şeyin halı: yarımçıqlıq, natamamlıq.

**QÜSURSUZ** *sif.* və *zərf* Heç bir qüsuru, eybi, nöqsanı, çatışmazlığı olmayan; nöqsansız, mükəmməl, müntəzəm. *Qüsursuz iş. Qüsursuz adam. Qüsursuz işləmək.*

**QÜSURSUZLUQ** *is.* Qüsursuz şeyin, adamın hal və keyfiyyəti; eyibsizlik, nöqsansızlıq, mükəmməllik.

**QÜTB** *is.* [*ər.*] 1. *coğr.* Yer kürəsinin üzərində fırlandığı xəyali mehvərin iki nöqtəsindən hər biri, habelə onun bu nöqtəyə düşən yeri. *Şimal qütbü. Cənub qütbünə ekspedisiya getmişdir.*

2. *elektr.* Elektrik dövrəsinin, maqnitin, yaxud elektromaqnitin iki ucundan hər biri.

3. *məc.* Bir-birinə tamamilə zidd olan cəhətlərdən hər biri.

**QÜVVƏ** *is.* [*ər.*] 1. Bir işi görə bilmək qabiliyyəti, iqtidarı, bacarığı. *Bu işi görməyə qüvvəsi çatmaz.* // Qüvvət, taqət, cismani enerji. *Qüvvədən düşmək. Bütün qüvvəsini sərf etmək.*

2. Zor, cəbr, qol gücü. *Qüvvə tətbiq etmək.*

3. Hər hansı bir enerjinin mənbəyi ola bilən maddi əsas, səbəb. *Ağırlıq qüvvəsi. Yerin cazibə qüvvəsi. Müqavimət qüvvəsi. İstehsal qüvvələri. Canlı qüvvə* (*insanlar və heyvanlar*).

4. Gərginlik, gərginlik dərəcəsi, şiddət. *Partlayış qüvvəsi. Elektrik cərəyanı qüvvəsi. Küləyin qüvvəsini ölçmək. Top səsinin qüvvəsindən qulaq tutulurdu.*

5. Güc, qüdrət, iqtidar, nüfuz. *Sülh tərəfdarlarının qüvvəsi yenilməzdir.*

6. Bir şeyin mahiyyəti, təsir qabiliyyəti, mənası, kəsəri, əhəmiyyəti, rolu. *Sözün qüvvəsi. Dəlillərin qüvvəsi.*

7. Hüquq nöqteyi-nəzərindən təsir, hökm, səlahiyyət, əhəmiyyət. *Dövlət planının qanuni qüvvəsi vardır. Qərar qüvvəsini itirməmişdir.* ◻ **Qüvvədə olmaq** – hamı üçün məcburi olmaq, tətbiq edilməkdə olmaq, qüvvəsi hələ davam etmək. **Qüvvəyə minmək** – hamı üçün məcburi olmağa başlamaq, tətbiqə başlamaq. *Yeni qanun qüvvəyə mindi.* **Qüvvədən düşmək** – öz qanuni hökmünü itirmək. *Köhnə qanunlar qüvvədən düşmüşdür.*

8. Adətən cəm şəklində. Cəmiyyətin hər hansı bir səciyyəvi əlamətlərə malik olan ictimai qrupu, təbəqəsi. *İnqilabın hərəkətverici qüvvələri. Dünyanın demokratik qüvvələri. Sülh qüvvələri. Sinfi qüvvələrin münasibətləri.*

9. Cəm şəklində. Qoşun. *Silahlı qüvvələr. Əsas qüvvələr* (ordunun əsas hissəsi). *Dəniz qüvvələri* (hərbi-dəniz donanması). *Hava qüvvələri* (hərbi-hava donanması).

10. *Cəm şəklində*. Hər hansı bir istehsalat kollektivini təşkil edən adamlar, bir-birinə yaxın ixtisas, peşə və s. sahəsində çalışan adamlar. *Klubda yerli qüvvələr konsert verəcək*.

11. *Zərf mənasında*. **Qüvvəsi ilə** – köməyi ilə, vasitəsilə, iştirakı ilə. *Laboratoriya tələbələrin qüvvəsi ilə düzəldilmişdir*.

12. Duyğu, hiss, qabiliyyət. *Görmə, eşitmə, iybilmə qüvvəsi. İradə qüvvəsi. Hafizə qüvvəsi. İdrak qüvvəsi*.

13. Maddi imkan, iqtidar. *O bahalıqda parçanı almağa mənim qüvvəm çatmaz*.

◊ **At qüvvəsi** – bax **at gücü** (“**at**”da). **İş qüvvəsi** – bax **iş**. **İşçi qüvvəsi** – bax **işçi**.

**QÜVVƏLƏNMƏK** bax **qüvvətlənmək**.

**QÜVVƏLİ** bax **qüvvətli**.

**QÜVVƏT** 1. Bax **qüvvə**. *O köpüyü ki, sən içdin, ondan sənin qollarına qüvvət, özünə də şairlik verildi*. “Koroğlu”. *Hünərim, qüvvətim bitməz, tükənməz! Qanadlı bir şahin yerdə görünməz*. A.Şaiq. ☐ **Qüvvət almaq** – qüvvətlənmək, güclənmək, ürəklənmək, ruhlanmaq. *Bayaqdan şil kimi sürünən qədəmlərim yeni qüvvət aldı*. M.S.Ordubadi. *Qüvvət alıb, ilham alıb; Yurd salmışam dağlarda mən*. S.Vurğun. **Qüvvət vermək** – 1) qüvvətini, mətanətini, təsirini artırmaq; qüvvətləndirmək, gücləndirmək, ruhlandırmaq; 2) təsdiq etmək, şərik olmaq, müdafiə etmək. *Mürşüdoğlu dəxi həkimin sözünə qüvvət verdi*. S.Rəhimov.

2. *riyaz*. Bir ədədin neçə kərə öz misli ilə vurulduğunu göstərən rəqəm.

**QÜVVƏTLƏNDİRİCİ** *sif. xüs*. Qüvvətləndirən, gücləndirən, gücləndirici. *Səsi qüvvətləndirici cihaz*.

**QÜVVƏTLƏNDİRİLMƏ** “Qüvvətləndirilmək”dən *f.is*.

**QÜVVƏTLƏNDİRİLMƏK** *məch*. Daha qüvvətli edilmək, gücləndirilmək; qüvvəti, gücü artırılmaq.

**QÜVVƏTLƏNDİRMƏ** “Qüvvətləndirmək”dən *f.is*.

**QÜVVƏTLƏNDİRMƏK** *f*. Daha qüvvətli etmək, daha güclü etmək; gücləndirmək, qüvvətini, gücünü artırmaq. *Ordunu qüvvətləndirmək. Radionun səsini qüvvətləndirmək. Tədqiqat işlərini qüvvətləndirmək. Müşahidələri qüvvətləndirmək*.

**QÜVVƏTLƏNMƏ** “Qüvvətlənmək”dən *f.is*.

**QÜVVƏTLƏNMƏK** *f*. Qüvvəti, gücü artmaq; daha güclü, daha qüvvətli olmaq; güclənmək. *Gecədən əsməyə başlayan yay küləyi yavaş-yavaş qüvvətlənir*. M.Hüseyn.

**QÜVVƏTLİ** *sif*. 1. Böyük fiziki qüvvəyə malik olan; çox güclü, çox sağlam. *Qüvvətli qollar. Qüvvətli pəhləvan. Qüvvətli adam. Qüvvətli əzələ*.

2. Böyük hərəkət qüvvəsinə malik olan. *Qüvvətli motor. Qüvvətli maşın. Tikintidə çox qüvvətli mexanizmlər işləyir*.

3. Çox güclü; yaxşı silahlanmış, möhkəm; böyük müdafiə və hücum imkanlarına malik. *Qüvvətli donanma. Qüvvətli ordu. Qüvvətli aviasiya*.

4. Böyük nüfuz və qüdrətə malik. *Qüvvətli dövlət. Qüvvətli hökmdar*.

5. *məc*. Əsaslı, inandırıcı, tutarlı, təsirli, çox mühüm. *Qüvvətli dəlillər. Qüvvətli mühakimə*.

6. Çox bacarıqlı, məharətli, istedadlı, öz işini yaxşı bilən. *Qüvvətli yazıçı. Qüvvətli tələbə*. – [Tələbəmə dedim:] *Görünür, ədəbiyyatdan qüvvətlisən; bir mənə de görüm, o ki Hacı Qara deyirsən, o kimin əsəridir?* Qantəmir.

7. *k.t*. Tərkibində qidalı maddələr bol olan, güclü. *Qüvvətli yemlər*. – *Bütün qış dövrü üçün mal-qaraya lazım olan miqdarda qaba, şirəli və qüvvətli yemlər ehtiyatı tədarük etmək lazımdır*. “Zootexniya”.

**QÜVVƏTLİLİK** *is*. Qüvvətli adamın, şeyin və s.-nin hal və keyfiyyəti; güclülük.

**QÜVVƏTÖLÇƏN** *is. xüs*. Maşın, mexanizm və ya insanın qüvvətini ölçmək üçün cihaz.

**QÜVVƏTSİZ** *sif*. 1. Gücü, qüvvəsi olmayan; gücsüz, qüvvəsiz, üzgün. *Qüvvətsiz adam. Qüvvətsiz qollar*. // Bacarıqsız, aciz. *Sən çox qüvvətsiz adamsan*.

2. Təsirsiz. *Qüvvətsiz dərman*. // Tərkibində qidalı maddələri çox az olan, yaxud olmayan; qidasız. *Qüvvətsiz yem. Qüvvətsiz çörək*.

**QÜVVƏTSİZLİK** *is*. 1. Gücsüzlük, taqətsizlik, zəiflik. *Qolların* (*qıçların*) *qüvvətsizliyi*. // Bacarıqsızlıq, acizlik.

2. Təsirsizlik. *Dərmanın qüvvətsizliyi*. // Qidasızlıq, qida maddələrinin çox azlığı, yaxud olmaması. *Yemin qüvvətsizliyi.*

**QVÁRDİYA** [*fr.*] 1. Ən yaxşı seçmə qoşun hissələri. *Qvardiya polku. Qvardiya hissələri. Qvardiya mayoru.*

2. *məc.* Hər hansı bir sahədə sınaqdan çıxmış, təcrübəli, qabaqcıl xadimlər; öz işinə sadiq olan mübarizlər. *Köhnə qvardiya. Köhnə fəhlə qvardiyası.* □ **Ağ qvardiya** – SSRİ-də 1918-1920-ci illərdə vətəndaş müharibəsi dövründə əksinqilabçı qoşunların ümumi adı. **Qırmızı qvardiya** – əksinqilab və ağqvardiyaçılarla mübarizə etmək üçün 1917-1918-ci illərdə təşkil edilmiş və Qırmızı Ordunun əsasını təşkil etmiş silahlı fəhlə dəstələri.

**QVARDİYAÇI** *is.* Qvardiyada xidmət edən əsgər, zabit. *Qvardiyaçılarımız düşmən üzərinə hücuma keçəndə qarı, boranı nəzərə almırdılar.* M.Hüseyn.

**QVAYÚLA** [*isp.*] İlk vətəni Şimali Amerika olan, Orta Asiya və Qafqazda bitən və kökündə kauçuk maddəsi olan həmişəyaşıl, alçaq kol bitkisi. *Bütün dünyada qvayula bitkisinin ikinci vətəni Azərbaycandır.*

# Ll

**L** Azərbaycan əlifbasının on səkkizinci hərfi. B a x **el**.

**LABİRÍNT** [*yun.*] 1. Qədim Yunanıstanda və Misirdə: çıxılması çətin, dolanbac və dolaşıq yolları olan böyük bina, tikili.

2. *anat*. Qulağın spiral, dəhliz və yarımdairəvi kanallardan ibarət hissəsi.

3. *məc.* Dolaşıqlıq, qarışıqlıq, dolanbaclıq. [Sərdarlı:] *..Labirintin sirri tapılmışdır.* Q.İlkin. // Başa düşülməsi, anlaşılması çətin olan qarışıq iş haqqında.

**LABORÁNT** [*lat.* laborans – işləyən] 1. Laboratoriyada çalışan elmi və ya texniki işçi. *Baş laborant. Laborant vəzifəsi.* – [Fərhadoğlu] *sonra öz laborantlarını da güclü bir selin gələcəyindən xəbərdar etdi.* S.Rəhimov. *Ay qız, – dedi, – laborant istəyirlər. Kimya ilə aran necədir?* Mir Cəlal.

2. Laboratoriya məşğələlərində müəllimə, professora kömək edən işçi. *Maarif müdiri haradan bilsin ki, laborant olmaya-olmaya məvacibi alınıb.* S.Rəhman.

**LABORANTLIQ** *is.* Laborant vəzifəsi, işi. *Laborantlıq etmək.*

**LABORATÓRİYA** [*lat.* laboratorium – işləmək] 1. Elmi və ya texniki təcrübələr, tədqiqat üçün xüsusi təchiz olunmuş bina, otaq; belə təcrübə, tədqiqat aparılan müəssisə. *Kimya laboratoriyası. Fizika laboratoriyası. – Laboratoriyadan Firuzənin səsi eşidildi.* C.Cabbarlı. *Surxay bəzən qızı kimya laboratoriyasında yalqız tapırdı.* İ.Əfəndiyev.

2. *məc.* Yaradıcılıq işi ilə məşğul olan sənətkarın fəaliyyət sahəsi. *Yazıçının yaradıcılıq laboratoriyası.*

**LABÜD** *zərf* [*ər.*] 1. Yerinə yetirilməsi, icrası vacib olan, zəruri olan; mütləq. *..Bayramda həlviyyat xonçası üstə bir əlbisəlik ipək parça labüd gedəcəkdir.* R.Əfəndiyev. // Mütləq olmalı olan, qaçılmaz, qarşısıalınmaz, zəruri. ☐ **Labüd olmaq** – vacib olmaq, zəruri olmaq. [Mürtəce ünsürlər] *xalqın və məmləkətin tərəqqisi üçün labüd olan bu məsələlərin həllini tələb edən hər kəsi .. töhmətləndirirlər*. M.İbrahimov.

2. Məcbur, çarəsiz, əlacsız, naçar, istər-istəməz, məcburiyyət qarşısında. [Şah Abbas:] *Ona binaən labüddəm ki, talaqınızı verib cümlənizi azad edim ki, hər kəsə meyliniz olsa, ona ixtiyar edəsiniz.* M.F.Axundzadə. *Sabira, torpağa saldı sayə rəna dilbərim; Gər mələk olsam da, labüd səcdeyi-xak eylərəm.* M.Ə.Sabir. ☐ **Labüd qalmaq** – zəruriyyət qarşısında məcbur olmaq, əlacsız qalmaq, çarəsiz qalmaq. *Mən labüd qaldım,* [hamballara] *deyim ki, bir surətdə ki, bunlar bizə qulaq asmırlar, bizə bunların xidməti heç lazım deyil.* C.Məmmədquluzadə. *Pul çox, amma xərc eləməyə yer tapmayırıq, labüd qalıb, pullarımızı xarici vilayətlərdə xərc eləyirik.* Ə.Haqverdiyev.

**LABÜDDƏN** *zərf* [*ər.*] 1. Hökmən, məcburən, mütləq. [Ağası bəy Vaqifə:] *Əgər Məmməd bəy .. mane ola bilməzsə .. labüddən vuruşma olacaqdır.* Çəmənzəminli.

2. İstər-istəməz, əlacsız, naçar, məcburən. [Qulam xan:] *Məni o qədər dəng elədin ki, axırda labüddən özümü bu bəlaya giriftar elədim.* M.S.Ordubadi. [Rəşid:] *Qurbanqulu dedi ki, mən yaya dayana bilmərəm, mənimçün indi toy edin, labüddən toy etdilər.* T.Ş.Simurq.

**LABÜDLÜK** *is.* Heç bir şeylə qarşısı alına bilməmə; qaçılmazlıq, önüalınmazlıq, zərurilik. *Hadisənin labüdlüyü.*

**LACİVƏRD** *is.* [*fars.*] Tünd-mavi rəngli qiymətli daş. // Bu daşın rəngi – tünd-mavi rəng. *Laciverd boşqab. – Lacivərd göylərin ətəklərini; Sarmış altun saçaqlı bir pərdə.* R.Rza. *Gündoğan tərəf utancaq bir qız yanağı kimi qızarır, incə buludlar mor, pənbə, lacivərd rənglərə boyanır.* M.Rzaquluzadə.

**LACİVƏRDİ** *sif.* [*fars.*] Tünd-mavi rəngli, lacivərd rəngində; göy. *Lacivərdi kasa. Lacivərdi səma. – Qələmkar süfrənin üstünə lacivərdi saxsı boşqablarda .. yemişlər qoyulmuşdu.* Çəmənzəminli. *Bu gün dərya açıqdı; Göy üzü lacivərdi.* M.Rahim.

**LACİVƏRDLİK** *is.* Lacivərd rəngində olma; tünd-mavilik, göylük.

**LAÇIN** *is.* 1. Keçmişdə quş ovlamaq üçün saxlanılan şahin cinsindən yırtıcı, alıcı quş. *Laçın yatağıdır bizim məkanlar.* Q.Zakir. *Eşq ilə çırpınan cəfayə dözər; Laçın alçaqda, həm*

*fəzada süzər*. A.Şaiq. // *məc. tənt*. Müqayisələrdə: cürət, hünər, igidlik rəmzi kimi işlənir. *Eyvazım bənzər laçına; Sonalar heyran saçına*. "Koroğlu". [Qərib:] *Ahu baxışlıdır, laçın cürətli; Uçmağa, qonmağa çıxası gözəl.* "Aşıq Qərib".

2. Bədii təşbehlərdə: gözəlin gözlərinə işarə. *Səyyad olub, qurub məhəbbət torun; Laçın gözlü, xub şikarı tutmuşam.* M.P.Vaqif. *Gecə-gündüz gözüm baxdı yollara; Bir laçın gözlünün nigaranıdı*. Q.Zakir.

**LAD** [*rus.*] Musiqidə: səs sırasını qurma, səsləri yerləşdirmə üsulu; musiqi əsərinin quruluşu. *Rast, şur, segah, şüştər, çargah, bayatı-şiraz və humayun Azərbaycan musiqisinin yeddi əsas ladıdır*. Ü.Hacıbəyov.

**LAƏQƏL, LAƏQƏLLƏN** *zərf* [*ər.*] *klas*. Ən azı, heç olmazsa. *Gecə-gündüz hər zaman olsa müsavi, eyd olur*; *Laəqəl, ey bixirəd, mən görmüşəm yüz ayü il*. Q.Zakir. *Var imiş evlənməyə də qüdrəti; Bəs niyə yox laəqəl üç külfəti?!* M.Ə.Sabir. *Yadımdadır ki, mən məktəbə getməyim ilə qayıdıb indi bura gəlməyimin arası olardı laəqəllən beş saat.* C.Məmmədquluzadə.

**LAƏLAC** *sif.* və *zərf* [*ər.*] Əlacsız, çarəsiz. □ **Laəlac qalmaq (olmaq)** – çarəsiz qalmaq, əlacı kəsilmək, çıxılmaz vəziyyətdə olmaq, məcburiyyət qarşısında qalmaq. *Laəlac olub, aqibət; Gənci şahmarə tapşırdım*. Q.Zakir. *Axırı laəlac qalıb özündən, özgədən on-on beş manat tədarük edib Məmmədhəsən əmi bir ulaq aldı*. C.Məmmədquluzadə.

**LAF** *is.* [*fars.*] Mükalimə, söhbət, danışıq, söz. *Gər doğru isə vəfadə lafın; Məndən nə üçündür inhirafın?* Füzuli. *Vəli, bihudə bir sözdür, deyirlər laf arasında*. M.V.Vidadi. [Səlim:] *İstəməz başqa laf; Söylə, açıq söylə, hər nə var söylə!* H.Cavid. // Boş söhbət, laqqırtı, əməli əhəmiyyəti olmayan söz, lüzumsuz və bihudə söz. *Hələlik gəl unudaq filməsəl öz lafımızı; İddiamızca açaq ayineyisafımızı*. M.Ə.Sabir. [İskəndər:] *Çox öyünmə, qüruru, lafı burax! Yaramaz bunca sadədil olmaq!* A.Şaiq. □ **Laf vurmaq (etmək)** – 1) danışmaq, söhbət etmək, söz demək. *Həddi nədir mənimlə vura laf eşqdən; Yanmaqda çox görüb özü pərvanə, könlümü.* Q.Zakir. *Eşqdə Məcnun kimi aləmdə çoxlar vurdu laf!* S.Ə.Şirvani. *Kağız sənə ağ göstərir öz sineyisafın; Guş eyləmə lafın; Çox tez qaralar qəlbi, mürəbbisi yamandır*. M.Ə.Sabir; 2) uzun-uzadı danışmaq, söhbət etmək; çərənləmək, boşboğazlıq etmək, laqqırtı vurmaq. *Keçən sözü çəkmə üzə, amandır! Yalan danışıban laf eyləmişəm.* Aşıq Ələsgər. *Bir az da Rüstəm keçmiş günlərindən laf vurub getdi*. Ə.Haqverdiyev.

**LAFÉT** [*fr.*] 1. Top altlığı, top qundağı.

2. Traktor və başqa nəqliyyatın dalına qoşulan yük arabası. *Pambığın daşınması üçün 4 yük avtomobili və 3 lafet ayrılmışdı. – Yusif .. aldığı alafı traktor lafetlərinə doldurub daşıtdırırdı*. B.Bayramov.

**LAFETLİ** *sif.* Lafeti olan, lafet qoşulan. *Lafetli traktor*.

**LAĞ** *is.* [*fars.*] Rişxənd, istehza, ələ salma, masqara. *Bu sual* [kişiyə] *yersiz, bir az da lağ kimi gəldi*. Mir Cəlal. □ **Lağ etmək (eləmək)** – ələ salmaq, istehza etmək, araya qoymaq, masqaraya qoymaq, gülmək. *Camalından mələk xəcalət çəkər; Hüsnün eylər aya, günə lağ, gəlin!* M.P.Vaqif. [Rəşid:] *Mənim nə həddim var sənə lağ eləyim.* Ə.Haqverdiyev. [Qızyetər:] *Bayaqdan lağ eləyirdi, indi özünün ürəyi gedir.* M.İbrahimov. **Lağa qoymaq** – b a x **lağ etmək (eləmək)**. *Odur, uşaq yenə kərbəlayıdan əl çəkmir, onu lağa qoyub yoruluncaya qədər gülürdü.* M.Hüseyn. [Hümmət Zülfüqara:] *Çıxart bu demaqoqu, sənə deyirəm. Küçələrdə bizi lağa qoyduğu daha bəsdir*. B.Bayramov.

**LAĞAN** *is. məh*. İtə xörək verilən qab.

**LAĞBAZ** [*fars.*] b a x **lağçı**.

**LAĞBAZLIQ** b a x **lağçılıq**. *Nazxanım bərkdən gülərək eyni lağbazlıqla* (z.) *oğlanın ardınca qışqırdı*. İ.Əfəndiyev.

**LAĞCIL** b a x **lağçı**. *Lağcıl adam*.

**LAĞCILLIQ** b a x **lağçılıq**.

**LAĞÇI** *is.* Rişxəndçi, istehzaçı, adam ələ salan, lağ etməyi sevən adam.

**LAĞÇILIQ** *is.* Adam ələ salma, lağ etməyi sevmə; rişxəndçilik.

**LAĞIM** *is.* 1. Yeraltı yol, yer altında qazılmış üstüörtülü xəndək. *Ağaclar dibində hava topları, hər tərəfdə gözətçi dəstələr qoyulduğunu, əyri lağımlar qazıldığını görüb getmədi*. Mir Cəlal. □ **Lağım atmaq (açmaq,**

**vurmaq)** – yer altından yol açmaq. *Bir çala-çuxur var hər addım başı; Yerin bağrına min lağım atılmış*. S.Vurğun.

2. Kanalizasiya.

3. Tunel mənasında. *..Digər tərəfdən də qatarların qaranlıq lağımlara girib-çıxmağı da yeznəmin və azarlının ovqat təlxliyini dəxi də artırırdı*. C.Məmmədquluzadə.

**LAĞIMATAN** b a x **lağımçı**. Qız *gördü ki, lağımçı gəlir. Tez lağımatanın qabağına çıxıb dedi..* (Nağıl).

**LAĞIMÇI** *is.* 1. Yeraltı yol qazıyan usta; lağımatan. [Qız:] *Ey lağımçı, bu qalaçadan padşahın dustaqxanasına lağımı neçə günə atarsan?* (Nağıl).

2. Kanalizasiya təmizləyən.

**LAĞIMÇILIQ** *is.* Lağımçının işi, peşəsi, sənəti. *Lağımçılıq eləmək.*

**LAĞIRTI** b a x **laqqırtı**. *..O heç gözlənmədən bu və ya digər qapını açıb girər, saatlarla min cür boş-boş əhvalatlardan danışıb lağırtı vurar.* M.İbrahimov.

**LAĞ-LAĞ** *sif.* və *zərf* 1. Boş, mənasız. ☐ **Lağ-lağ danışmaq** – boş-boş danışmaq. *Getdi, mənə nə, fəhləliyin badə, əkinçi; Lağ-lağ danışıb başlama fəryadə, əkinçi!* M.Ə.Sabir.

2. B a x **lağlağı**[1]. [Feldşer] *çox uzunçu, lağ-lağ, həm də qaba bir adamdı.* M.Hüseyn.

**LAĞLAĞI**[1] *sif.* Çoxdanışan, boşboğaz, naqqal: ağzına və ağlına gələni danışan. *Lağlağı adam*. // İs. mənasında. [Dilmanc:] *Ay kişi, Danabaş kəndində nə çox lağlağı var imiş!* C.Məmmədquluzadə. *Hər ötərgi lağlağıya, söylə, neçin əl çalırsan; Neçin tərlan ovlağından sən yerlərə alçalırsan?* S.Vurğun.

**LAĞLAĞI**[2] b a x **lağ**. *Lağlağı eləmək. Lağlağıya qoymaq*.

**LAĞLAĞIÇI** *sif.* b a x **lağlağı**[1]. *Əhali Nadir ilə Zeynəbin görüşməsini bildi, .. lağlağıçı adamlar da onlara bir neçə söz qoşdular.* B.Talıblı.

**LAĞLAĞILIQ** *is.* Boş-boş və çox danışma; naqqallıq, boşboğazlıq. *Lağlağılıq etmək.*

**LAĞ-LOĞAZ: lağ-loğaza qoymaq** – b a x **lağa qoymaq** (“**lağ**”da).

**LAHUT** [*ər.*] *klas. şair.* İlahilik, ülviyyət.

**LAHUTİ** [*ər.*] *klas. şair*. İlahi. [Yaşlı kişi:] *Özümü lahuti bir mənzərə qarşısında təsəvvür edirdim.* S.Hüseyn.

**LAX**[1] *sif.* 1. Çürüyüb pis qoxu verən, qoxumuş, xarab olmuş. *Bu pula heç bir lax yumurta verməzlər*. S.Rəhimov. [Fərəcov Qarakişiyə:] *Əlbəttə, lax yumurta yığsan cücə çıxmaz*. B.Bayramov.

2. *məc. dan*. Mənasız, boş, düzgün olmayan.

◊ **Lax çıxmaq** – baş tutmamaq, boşa çıxmaq, nəticəsi olmamaq.

**LAX**[2] *sif.* Yerində möhkəm durmayan, laxlayan, tərpənən, boş. *Stulun qıçları laxdır. – Zavodun .. pəncərələri, kiçik qapıları lax, dəzgahları isə köhnə və ibtidai idi*. M.Hüseyn. // Ölçüdən böyük olan; boş. *Ayaqqabı ayağıma laxdır.*

**LAXBALAX** *zərf dan*. Hər iki tərəfi açıq, taybatay, laybalay. *Pəncərə laxbalax açıqdır.* – [Qaraqaş] *bir təpik qapıya çəkdi, qapı laxbalax açıldı.* (Nağıl).

**LAXLADILMA** “Laxladılmaq”dan *f.is.*

**LAXLADILMAQ** *məch.* Lax hala salınmaq, boşaldılmaq. *Mizin ayaqları laxladılıb.*

**LAXLAMA** “Laxlamaq”dan *f.is.*

**LAXLAMAQ** *f.* Yerindən oynamaq, yerində möhkəm durmamaq, lax olmaq, tərpənmək, boşalmaq; möhkəmliyini, sabitliyini itirmək. *Stulun qıçları laxlayır. – Kərbəlayı Ağcanın fikrində bu idi ki, .. Kazımı çəpərə elə çırpsın ki, çəpərin taxtaları laxlasın*. Çəmənzəminli. *Hələ də* [Nisə xalanın] *ağzında bircə dişi laxlamayıb.* Qantəmir. // *məc.* Sarsılmaq, möhkəmliyini itirmək.

**LAXLAMIŞ** *f.sif.* Boşalmış, yerindən oynamış, tərpənən, laxlayan. *Gödək adam ombasından laxlamış olan qılçasını sürüyə-sürüyə getdi.* Mir Cəlal.

**LAXLATMA** “Laxlatmaq”dan *f.is.*

**LAXLATMAQ** *f.* 1. Bir yerə vurulmuş, basdırılmış və ya bənd edilmiş, kip taxılmış şeyi çox tərpədərək boşaltmaq, lax hala gətirmək. *Mıxı laxladıb çıxartmaq. – Bəzən* [Dəmirov] *göy xallı atın cilovunu bir adama verib dəmir lomu özü götürür, bir daşı laxladıb yerindən çıxarır.* S.Rəhimov.

2. *məc.* Sarsıtmaq, zəiflətmək. *Qoşunun əlahəzrətə itaət etməməsi onun mövqeyini laxladır*. M.S.Ordubadi.

**LAXLIQ**[1] *is.* Lax yumurtanın hal və keyfiyyəti.

**LAXLIQ²** *is.* 1. Lax şeyin halı.

2. *məc.* Boşluq, laqeydlik, ciddiyyətsizlik. *Bizim bəzilərimizdə bir laxlıq, ətalət var.* Ə.Əbülhəsən.

**LAXTA¹** *is.* və *sif.* Bərkiyib qatılaşmış qan kütləsi. *Qalın topa birçəkləri öz qanı ilə boyanmış; Bığlarının kənarında qan laxtası dayanmış.* A.Səhhət. *Nə iş, nə idarə, nə də bir insan; Hər tərəf daş, torpaq, dəmir, laxta qan.* M.Rahim.

**laxta-laxta** *sif.* Laxtalar halında, parça-parça. *Laxta-laxta qan qusmaq. – Dargınam mən belə baxta; Ürəyim qan laxta-laxta.* Ə.Cavad. *Ceyran, Ayaz çox aradı, Aslandan tapmadı bir iz; Yalnız təpə ətəyində laxta-laxta* (z.) *durmuşdu qan.* A.Şaiq.

**LAXTA²** *sif. dan.* Ətli-canlı, kök. *Laxta uşaq.*

**LAX-TAX** *dan. sif.* Boş, sakit, səssiz, kimsəsiz, adamsız. *Axundun lax-tax evi bu gün gəlib-gedən ilə dolu idi.* S.Rəhman.

**LAXTALANMA¹** “Laxtalanmaq¹”dan *f.is.* *Qanın laxtalanması.*

**LAXTALANMA²** “Laxtalanmaq²”dan *f.is.*

**LAXTALANMAQ¹** *f.* Laxta halına düşmək; bərkimək, kəsifləşmək, qatılaşmaq (qan haqqında). *Oğlanın gicgahında qan laxtalanmışdı.* M.Hüseyn. [Kamalın] *çiynindən sızan qan döşündə laxtalanırdı.* Ə.Vəliyev.

**LAXTALANMAQ²** *f. dan.* Dolğunlaşmaq, irilənmək, böyümək. *Ay doğdu, laxtalandı; Doğduqca laxtalandı; Yarıma xəbər verin; Məzarım taxtalandı.* (Bayatı).

**LAXTALAŞMA** “Laxtalaşmaq”dan *f.is.*

**LAXTALAŞMAQ** b a x **laxtalanmaq¹**.

**LAK¹** [*ital.*] Parıltı vermək, həmçinin korlanmaqdan qorumaq üçün əşyanın üzərinə çəkilən spirtdə, yağda, skipidarda həll olunmuş qatran. *Qara lak. Şkafa lak çəkmək.* // Üzərinə həmin mayedən çəkilmiş parıltılı dəridən və s.-dən tikilmiş, düzəldilmiş. [Suğra] *güllü-çiçəkli krepdeşindən lap yeni dəblə tikilmiş uzun bir don, lak tufli geymiş, hətta sırğa da taxmışdı.* M.Hüseyn. *Cavanların arasından çesuça kostyumla lak çəkmə geyinmiş, saçlı, tökmərək bir oğlan çıxıb irəli gəldi.* Ə.Əbülhəsən.

◊ **Lak ağacı** *bot.* – əsasən Çin və Yaponiyada bitən, köklərindən lak alınan tropik ağac.

**LAK²** Dağıstanda yaşayan Qafqaz xalqlarından biri və bu xalqa mənsub adam. *Lak dili. Lak kəndi.*

**LAKCA** *sif.* və *zərf* Lak dilində (b a x **lak²**). *Lakca-rusca lüğət. Lakca danışmaq.*

**LAKÇI** *is.* Dəriyə, mebelə lak çəkən usta.

**LAKÉY** *is.* [*fr.*] 1. Nökər. *Lakeylər səf-səf durub, bir-bir “ağa, xoş gəlibsiniz!” deyirdilər.* Ə.Haqverdiyev.

2. *məc.* Şəxsiyyətsiz adam, yaltaq. [N.Vəzirovun “Pəhləvanani-zəmanə” əsərində] *xalqın həm maddi, həm də mənəvi sərvətinə, həm dilinə, həm də torpağına və neftinə şərəfsiz və qeyrətsiz münasibət bəsləyən simasızlar, rəyasət və manat lakeyləri təsvir olunurlar.* Y.Qarayev.

**LAKİN** *bağl.* [*ər.*] Cümlələri, habelə cümlə üzvlərini (əsasən həmcins üzvləri) birləşdirərək qarşılıq bildirir. *Bir qız tanıyırdım, lakin nə adını bilirdim, nə də kim və nəçi olduğunu öyrənə bilmişdim.* S.Hüseyn. *İzzət qarı obaya yaxınlaşıb dincini almaq istədisə də, lakin üfüqdə qızartı işarəsi görüb fikrini dəyişdi.* Ə.Məmmədxanlı.

**LAKLAMA** “Laklamaq”dan *f.is.*

**LAKLAMAQ** *f.* Lak vurmaq, lak sürtmək, lakla örtmək. *Bufeti laklamaq. Stolu laklamaq.*

**LAKLANMA** “Laklanmaq”dan *f.is.*

**LAKLANMAQ** *məch.* Lak çəkilmək, lak sürtülmək, lakla örtülmək.

**LAKLATDIRMA** “Laklatdırmaq”dan *f.is.*

**LAKLATDIRMAQ** *icb.* Lak çəkdirmək, lak sürtdürmək, lak vurdurmaq.

**LAKLI** *sif.* Lak çəkilmiş, lak sürtülmüş, lakla örtülmüş. *Laklı dəri.* // Lak qatılmış. *Laklı rəng.*

**LÁKMUS** [*holl.* lakmoes] Dəniz şibyələrindən hasil edilən, kağıza turşuların təsirilə qırmızı, qələvilərin təsirilə isə göy rəng verən boyayıcı maddə. *Lakmus, əksəriyyətlə Hollandiyada bitən kəvərəoxşar göyərtidən alınır. Bu bitkinin suda həll edilmiş məhlulu bənövşəyi olub, turşulardan qırmızı, əsaslardan isə abı rəng alır.* A.Quliyev. ☐ **Lakmus kağızı** – qələvi və turşularda reaktiv kimi işlədilən lakmus məhlulu hopdurulmuş süzgəc kağızı. **Lakmus otu** *bot.* – yarpaq və meyvələrindən göy rəng alınan ot bitkisi.

**LAKONİK** *sif.* [*yun.*] Qısa, yığcam, azsözlü.

**LAKTÁSİYA** [*lat.*] *fiziol.* İnsanlarda və məməli heyvanlarda süd vəzilərində südün əmələ gəlməsi, toplanması və onun ifrazı prosesi. // Bu prosesin davam etdiyi müddət.

**LAQEYD** [*ər.*] 1. *sif.* Heç bir şeyin fikrini, qeydini çəkməyən, heç bir şeyə əhəmiyyət verməyən, hər şeyi qulaqardına vuran. *Laqeyd adam.*

2. *zərf* Etinasız, maraqsız, soyuq, saymaz. *Mən nə qədər ki, ona qarşı laqeyd və etinasız davranırdım, əksinə olaraq, o mənə bir o qədər artıq təmayül göstərir*(*di*). S.Hüseyn. *Xanımı özümdən şübhələndirməmək üçün mən özümü sakit və laqeyd göstərməyə çalışırdım.* T.Ş.Simurq. [Qara:] *Mənə qarşı nə üçün bu qədər laqeyd idilər?* İ.Hüseynov. ◻ **Laqeyd qalmaq** – etina etməmək, fikir verməmək, fikrə, hərəkətə qarşı laqeydlik, saymazlıq göstərmək. // Laqeydcəsinə, soyuq. *Tanrıverdi soyuq və laqeyd bir tövr ilə: – Hacı Qurbanın nəşi quyudamı qalacaq? – deyə soruşdu.* A.Şaiq.

**LAQEYDANƏ** [*ər.* laqeyd və *fars* ...anə] bax **laqeydcə(sinə)**. *Qorodovoy qış günəşinin isticə şüası altında laqeydanə xoruldayırdı.* Çəmənzəminli.

**LAQEYDCƏ(SİNƏ)** *zərf* Heç bir şeyin fikrinə, qayğısına, qeydinə qalmadan; laqeydliklə, fikir vermədən, maraqlanmadan. *Laqeydcəsinə baxmaq. Laqeydcə ötüb keçmək.*

**LAQEYDLƏŞMƏ** "Laqeydləşmək"dən *f.is.*

**LAQEYDLƏŞMƏK** *f.* Laqeyd olmaq, heç bir şeyə maraq göstərməmək, soyuqqanlı olmaq.

**LAQEYDLİK** 1. *is.* Hər şeyə laqeyd münasibət, maraqsızlıq göstərmə; etinasızlıq, başısoyuqluq, qayğısızlıq, qeydsizlik. [Qoşatxan:] *Laqeydlik kənd müəllimi üçün dözülməz bir bəladır, deməli, heç şey onun ürəyini yandırmır.* M.İbrahimov. ◻ **Laqeydlik göstərmək** – laqeyd, etinasız yanaşmaq, başısoyuqluq göstərmək, maraq göstərməmək, saymamaq. *Elə mən də; Ondan məktub gələndə; Laqeydlik göstərib; Bəzən cavab yazmadım.* Z.Xəlil.

2. **Laqeydliklə** şəklində *zərf* – bax **laqeydcə(sinə)**. *Qoşun dəstələri şəhəri çox soyuqqanlılıqla gəzir, atışma yerlərindən laqeydliklə keçirdilər.* M.S.Ordubadi. *Cəmil sifətini laqeydliklə boz dağlara tərəf çevirdi.* Q.İlkin.

**LAQ-LAQ** *təql.* Leyləyin çıxardığı səs. *Dəmirçinin ömrü taq-taqla, leyləyin ömrü laqlaqla keçər.* (Ata. sözü).

**LAQQALAQ** *təql.* Darboğaz qabdan tökülən və ya qaynayan mayenin, yaxud da heyvanların dillə bir şeyi yalayarkən çıxardığı səs. *Samovar laqqalaq qaynayır. Qazan laqqalaq qaynayırdı. – Əli dəhrə ilə erkəyi şaqqalayanda .. çənbər ənik çaladakı qanı laqqalaq yalayırdı.* Ə.Vəliyev.

**LAQQILDAMA** "Laqqıldamaq"dan *f.is.*

**LAQQILDAMAQ** *f.* Darboğaz qabdan axan su və ya qaynayan mayenin çıxardığı səsə bənzər səs çıxarmaq.

**LAQQILTI** *is.* 1. Laqqıldayaraq axan və ya tökülən mayedən çıxan səs.

2. Bax **laqqırtı**.

**LAQQIRTI** *is.* Söhbət, danışıq, laf (çox vaxt mənasız, boş, qeyri-ciddi söhbət mənasında). [Nurcahan xala] *dəstələrdən birinə yanaşaraq laqqırtıya başlardı.* H.Sarabski. *Beş-altı nəfər könüllü gələn cavan şarbafın həyətdən laqqırtısı eşidilirdi.* Ə.Əbülhəsən. [Hüseyn] *çox gülməyi, boş-boşuna danışmağı, laqqırtını sevməzdi.* S.Rəhman. ◻ **Laqqırtı vurmaq** – söhbət etmək (adətən uzun-uzadı, boş və mənasız söhbətlə məşğul olmaq). *..Bir dükanda neçə nəfər əyləşib laqqırtı vurur.* Ə.Haqverdiyev. *..Məhəllədən xeyli aralı oturub laqqırtı vuran dəliqanlılar gözlərini Sadıq kişiyə zilləyib söhbət edirdilər.* M.Hüseyn.

**LAL** *sif.* 1. Danışmaq qabiliyyətindən məhrum olan, danışa bilməyən. *Lal adam.* // İs. mənasında. *Lalın dilini anası bilər.* (Məsəl). *Biz yetişdik yığın-yığın kor, lal; Hər tərəfdən sağır, çolaq və topal.* H.Cavid. ◻ **Lal eləmək** *məc.* – susdurmaq, danışmaq iqtidarından məhrum etmək. *Bir qüvvə bunların hər ikisini guya lal eləmişdi.* İ.Musabəyov. *..Mədinə saray gözəllərini lal edəcək bir hüsnlə Vaqifə baxır, onun qəlbini hər dəqiqə*

*yaralayırdı.* Çəmənzəminli. **Lal əlifbası** – lalların barmaqları vasitəsilə şərti işarələr göstərməkdən ibarət danışma üsulu. **Lal olmaq** – danışmaq qabiliyyətini itirmək, danışa bilməmək. // Susmaq, səsini kəsmək, sükut etmək, danışmamaq, dili tutulmaq. *Teymur baxır ki, bayaqdan tutuquşu kimi danışan vəzirlər, əyanlar Molla Nəsrəddini görcək lal oldular.* "M.N.lətif." *Lal olmuşam onu sevəndən bəri; Yoxsa qalmaz idim söz qabağında.* Q.Zakir. *Düşdün niyə bəs bu hala əlhal? Bilməm nə səbəbdən olmusan lal?* M.Ə.Sabir. **Lal durmaq** – susmaq, susub durmaq, dinməmək, sükut etmək. [Nurəddinin] *içərisindən xəbəri olmayan adamlar onun belə lal durmasını vəfasızlıq .. zənn etdilər.* S.S.Axundov. **Lal olasan! (olsun!)** – qarğış məqamında işlənir. *Əzizim, dəydi yara; Su gəldi, dəydi yara; Lal olasan, ay dilim; Nə dedim, dəydi yara?* (Bayatı).

2. *məc.* Ahəstə, sakit, səssiz. *Gecə sakit, gecə lal; Gecə qərib bir xəyal; Qaralmış pəncərələr.* S.Vurğun. [Salam] *lal* (z.) *axan kəhriz suyundan ovuc dolusu içdi.* Mir Cəlal.

◊ **Lal xəritə** – tədris vəsaiti kimi istifadə edilən yazısız coğrafi xəritə. **Lal səhnə** – teatr tamaşalarında, kinofilmlərdə danışıqsız, səssiz səhnə.

**LALAPİTİ(K)** *sif.* Tamam lal olmayıb, ancaq kəlməni bütöv tələffüz edə bilməyən. *Lalapiti(k) adam.*

**LAL-DİNMƏZ** 1. *zərf* Səs çıxarmadan, dinmədən, danışmadan, susaraq. *Lal-dinməz oturmaq. – Səlimnaz lal-dinməz dayanıb, bütün bədəni ilə qapını tutmuşdu.* M.Hüseyn. *Bir ara lal-dinməz hamı onun dalınca baxdı.* Ə.Əbülhəsən. // Sözsüz, danışıqsız, qeyd-şərtsiz. *Lal-dinməz əmri yerinə yetirdi.* – [Nigar Muradın] *hər əmrinə lal-dinməz tabe idisə də, üzü heç gülmürdü.* S.Hüseyn.

2. *sif.* Azdanışan, danışmağı sevməyən, çox zaman dinməz, sakit oturan. *İndi onlar həmişəki kimi müti və lal-dinməz adamlar deyildir.* P.Makulu.

**LALƏ** *is.* [*fars.*] 1. *bot.* İriləçəkli qırmızı çiçəkləri olan bitki və bu bitkinin çiçəyi. *Bitər çəməndə lalələr, əlində al piyalələr; Səhər zamanı dür kimi düşər ot üstə jalələr.* A.Səhhət. *Otların arasında saysız-hesabsız lalələr qızarırdı.* İ.Əfəndiyev. // Bu çiçəyin müxtəlif rəngdə yetişdirilmiş növü.

2. Qırmızılıq rəmzi kimi işlənir. *Nigarın ala gözlərindən damcı-damcı yaş gilələnib lalə yanaqlarından aşağı gəldi.* "Koroğlu". *Yanağı laləsən, qaməti dalsan; Ağzı şəkər, dili-dodağı balsan.* M.P.Vaqif.

**LALƏÇİÇƏKLİLƏR** *cəm bot.* Lalə və bəzi başqa bitkilərin daxil olduğu bitki fəsiləsi.

**LALƏDODAQ** *sif. şair.* Dodaqları lalə kimi qırmızı. *Bu evlər, lalədodaq kəndli qızları, hamısı* [Əsgərə] *məxsus idi.* S.Rəhman.

**LALƏGUN** *sif.* [*fars.*] *klas.* Lalə rəngində, lalərəngli, lalə kimi qırmızı. *Tərk etdi libasi-laləguni.* Füzuli. ☐ **Laləgun olmaq** *klas.* – qana boyanmaq, qanla dolmaq. *Töküldü bigünah qanlar; Ürəklər laləgun oldu!* M.Ə.Sabir. *Vətən uğrunda, millət eşqində; Laləgun oldu qanlarında kəfən.* Ə.Qəmküsar.

**LALƏLƏNMƏ** "Lalələnmək"dən *f.is.*

**LALƏLƏNMƏK** *f.* 1. Lalə açılmaq, lalə ilə örtülmək. *Yaz gəldi, çöllər lalələndi.*

2. Qırmızı rəng almaq; qızarmaq. *Al bayraqlar; Lalələnib sinəsində; Doğma yurdun; Azad gözəl bu vətənin.* R.Rza.

**LALƏLİ** *sif.* Lalə bitmiş, lalə əkilmiş, lalə olan. *Laləli çəmən. Laləli bağ. – Bahar fəsli, yaz ayları gələndə; Süsənli, sünbüllü, laləli dağlar!* Aşıq Ələsgər. *Laləli çöllərdə doğrudan da sən; Tərlan, səhərlərin ilk müjdəsisən.* S.Vurğun.

**LALƏLİK** b a x **laləzar**. *Al-əlvan geyinmiş qızlar çöllərə səpələnib gül-çiçək dərir, sinəsi qızaran taxılların arası ilə qaçıb laləlikdə görünməz olurdular.* İ.Şıxlı.

**LALƏRƏNG** *sif.* [*fars.*] *şair.* Lalə rəngində, lalə rəngli, qırmızı. *Durnanın qatarı gör nə qəşəngdir; Səhər buludları nə lalərəngdir!* R.Rza. ☐ **Lalərəng etmək** – qızartmaq, lalə rəngi vermək. *Lalərəng etdi gözüm qan ilə xaki-dərini; Kimyagərdir, edər gördüyü torpağı qızıl.* Füzuli.

**LALƏRÜX** *klas.* b a x **laləyanaq**. *Lalərüxlər köysümün çakinə qılmazlar nəzər; Hiç bir rəhm eyləməzlər daği-pünhanım görüb.* Füzuli. *Ey lalərüxüm, könlümə heyranəm əzəldən; Dözmüş necə hicraninə min dağ ilə sənsiz.* Ə.Vahid.

**LALƏYANAQ** *sif. şair.* Yanaqları, üzü lalə kimi qırmızı; alyanaq, qırmızıyanaq.

**LALƏZAR** *is.* [*fars.*] *şair*. Laləlik, çiçəklik, güllük, çoxlu lalə bitən yer. *Baxdı ki, bura elə çəmənzar, laləzar bir yerdir ki, day nə deyim.* “Koroğlu”. *Qış getdi, yenə bahar gəldi; Gül bitdi və laləzar gəldi.* Xətayi. // Məc. mənada. *Atəş kənarı qış gününün laləzarıdır*. (Ata. sözü). *Bu gün xoş, günəşli, laləzar olan hava, sabahı buludlu, küləkli, çiskinli bir hal alır*. M.Rzaquluzadə. *Hər tərəfim laləzardır; İgid oğlum, qızım vardır*. M.Dilbazi.

**LALƏZARLIQ** b a x **laləzar**. [Rizvan] *bura hər cür ağacdan, güldən əkib, bura olub bir laləzarlıq*. (Nağıl). [Zeynəb] *bir azdan sonra yorulub bir laləzarlıqda oturdu və lalələrdən gəlin qayırmağa başladı*. S.S.Axundov.

**LALIQ** *sif.* Həddindən artıq dəyib boşalmış, yetişib vaxtı ötmüş; lırt. *Lalıq armud. Lalıq zoğal*.

**LALIQLAMA** “Lalıqlamaq”dan *f.is.*

**LALIQLAMAQ** *f.* Həddindən artıq yetişmək, dəyib sulanmaq, boşalmaq. *Əzgillər lalıqlamış, armudlar dəymişdi.* Ə.Vəliyev. *Lalıqlayan ətli zoğal hərdən bir-bir, ikibir nova düşür, damaq şaqqıltısı kimi səslənirdi*. B.Bayramov.

**LALIQLANMA** “Lalıqlanmaq”dan *f.is.*

**LALIQLANMAQ** *f.* Həddindən artıq yetişmək, dəyib sulanmaq, lalıq hala gəlmək.

**LALIQLAŞMA** “Lalıqlaşmaq”dan *f.is.*

**LALIQLAŞMAQ** b a x **lalıqlanmaq**.

**LALIQ-MALIQ** *sif. dan*. Dilsiz-ağızsız, sözünü, fikrini başa sala bilməyən. *Lalıq-malıq uşaq*.

**LAL-KAR** 1. *sif.* Həm danışmaq, həm də eşitmək qabiliyyəti olmayan. *Lal-kar uşaq*. // İs. mənasında. *Lal-karlar məktəbi*.

2. *zərf* Dinməz-söyləməz, danışmadan, heç bir söz demədən. *Lal-kar oturmaq. Lal-kar durmaq. – Qardaşının daş kimi lal-kar olması onu* [Şahnigarı] *lap vahimələndirdi.* İ.Şıxlı. [Nərgiz ilə Səməndər] *bir müddət lal-kar getdilər*. B.Bayramov.

3. *zərf* Hərəkətsiz, sakit. *..Baxışlar danışdı lal-kar; Onlar birdən-birə qucaqlaşdılar.* B.Vahabzadə.

**LAL-KARLIQ** *is.* Həm danışmaq, həm də eşitmək qabiliyyətindən məhrumluq; lal və kar adamın halı.

**LALLAŞMA** “Lallaşmaq”dan *f.is.*

**LALLAŞMAQ** *f.* Lal olmaq, danışmaq qabiliyyətini itirmək.

**LALLIQ** *is.* Lal adamın halı.

**LAL-MAT** *zərf* Heyrət içərisində; susaraq. *Arvad belə rəftarı gördükdə lal-mat geri dönüb qayıtdı*. B.Talıblı.

**LAM**[1] *sif.* və *zərf məh*. b a x **lal** 2-ci mənada. *..Alagöz artıq birbaş lam axan Kürə doğru addımlayırdı*. S.Rəhimov. *Bu böyük, sakit, lam axan çaya baxdıqca İlyasın gözü axırdı*. Mir Cəlal.

**LAM**[2] [*ər.*] Ərəb əlifbasında “ل” şəklində yazılan hərfin adı. *Üç hərflə ismin eylədin aşkar; Biri kafdı, biri lamdı, biri sad.* Aşıq Ələsgər.

**LAMA**[1] [*isp.*] *zool.* Dəvə ailəsindən *Cənubi Amerika yük heyvanı.*

**LAMA**[2] [*tibet.*] Tibet və Monqolustanda: lamaizm rahibi.

**LAMAİST** [*tibet.*] Lamaizm tərəfdarı, lamaizm dininə inanan adam.

**LAMAİZM** [*tibet.*] Tibet və Monqolustanda yayılmış buddizm məzhəblərindən biri.

**LAMƏHALƏ** *zərf* [*ər.*] *dan*. Heç olmazsa, ən azı. [Hacı Nuru:] *Amma necə ki, siz deyirsiniz, iksirə laməhalə başqa filizat lazımdı ki, onun təsirini qəbul edə*. M.F.Axundzadə. *Bizimçün laməhalə üç dilin təlimi lazımdır.* S.Ə.Şirvani. *Topla nə gücün varsa, giriş qəticidalə; Ya haqqını al, ya əbədi öl, laməhalə!* C.Cabbarlı.

**LAMƏKAN** *sif.* [*ər.*] *klas*. Məkansız, yeri, məkanı olmayan. *Vətəndən ayrı düşüb indi laməkan* (z.) *ölürəm*. X.Natəvan.

**LAMƏZHƏB** *sif.* [*ər.*] Məzhəbsiz, dinsiz, Allahsız. // İs. mənasında. [Hacı Səmsam:] *Mən bu laməzhəblərin hər birinin başına on tümən verəcəyəm.* P.Makulu. // Söyüş məqamında işlənir. [Kərbəlayı:] *Pərvərdigara, .. ikinci, başıma tənbəki oyunu açdı, onu boşadım, bu da mürtəd qızı, laməzhəb qızı.* Çəmənzəminli. ☐ **Laməzhəb olmaq** – dindən çıxmaq, dini etiqadlara inanmamaq, onlara şəkk etmək. [Qurban usta Zeynala:] *Usta, birisi .. laməzhəb oldu, heç bir şeyə qayımlığı olmadı, çətindi onu inandırmaq*. C.Məmmədquluzadə. [Kitabpaylayan:] *Yəqin Mirzə Fətəli, necə ki, özü laməzhəb olub, Allahın yolundan çıxıb*. Ə.Haqverdiyev.

**LAMİSƏ** *is.* [*ər.*] Toxunmaqla hiss etmə. *..Bir çox karlarda, korlarda yüksək iybilmə, lamisə həssaslığının olduğu məlumdur.* M.Məhərrəmov.

**LAMPA** *is.* [*fr.*] 1. Müxtəlif növ və quruluşlu, işıq verən cihaz. *Neft lampası. Onluq lampa. Şarlı lampa.* – [Murad] *əlini qoltuq cibinə salıb dəfələrlə oxuduğu məktubu aldı. Lampa işığında təkrar oxumağa başladı.* S.Hüseyn. *Evin ortasında düzülmüş iki-üç otuzluq lampanın işığı evi daha da gümrahlaşdırmışdı.* H.Sarabski. // b a x **lampoçka**. *Üstü içki və məzələrlə dolu bir masa, üzərində elektrik lampası*. H.Cavid.

2. *xüs*. Müxtəlif istehsal proseslərində istifadə edilən işıqverən və ya qızdırıcı cihaz. *Lehimləmə lampası. Elektron lampası. Mədən lampası.*

**LAMPACIQ** *is.* Kiçik lampa, balaca lampa.

**LAMPAÜSTÜ** *is.* Lampanın üstünə keçirilən, salınan şar, örtük və s.

**LAMPOÇKA** [*rus.* лампа söz. kiç.] Elektrik lampası. *Bir anda bütün ətrafda yüzlərlə lampoçka yandı.* M.İbrahimov. *Rüxsarə lampoçkanı əlləşdirdi, onun içəri tellərinin qırılmış olduğunu gördü*. S.Rəhimov.

**LANDŞÁFT** [*alm.*] 1. *coğr*. Hər hansı bir yerin tipik əlamətlərinin məcmusu. // Yer səthinin quruluşu.

2. Mənzərə.

**LANSÉT** *is.* [*alm.*] Cərrah aləti.

**LAP** *əd*. Sözlərin qabağına gələrək, onların mənasını daha da şiddətləndirir, dəqiqləşdirir. *Bu söz onun lap ürəyindən oldu. Yayın lap isti günü idi. Evdə lap tək qalmışdım. – Sürtdü kamançaya ayı əllərin; Az qaldı ki, lap qopara tellərin.* A.Səhhət. *Bir həftə idi ki, Usta Ağabala dəllək yanına getməmişdi, başını tük lap deşirdi*. Çəmənzəminli. *Yolçu səsini lap yavaşıdıb soruşdu*. S.Rəhman.

**LAPAN** *is. bot*. Dilim-dilim iri yarpaqları olan ağcaqayın növündən ağac.

**LAPAR-LAPAR** *sif.* 1. Parça-parça; xallar, ləkələr şəklində. *Lapar-lapar qızartı. Lapar-lapar güllü parça. – Dəvə gedir, ayaq izi qumsallıqda lapar-lapar; Buz qütbündə addımlasa nəfəsindən buzlaq qopar.* X.Rza.

2. Sakit havada iri parçalar şəklində (yağan) qar haqqında. *Lapar-lapar qar yağır.*

**LAPCA** b a x **lap**. *Ay balam, eybini qan; Bir həya eylə, utan! Yoxsa təkfir edərik! Lapca rüsva olasan?!* M.Ə.Sabir.

**LAPÇIN** *is.* 1. Uzunboğaz ayaqqabı növü. *Lapçının üzlüyü keçədən, altı göndən tikilirdi.*

2. *məh*. Əsasən evdə geyilən yüngül ayaqqabı. [Sübhanverdizadə] *rezinli plaşa bürünmüş, ayaqlarına lapçın keçirmişdi.* S.Rəhimov.

**LAPDAN** *zərf* Gözlənilmədən, qəfildən, birdən. *Lapdan işıq söndü. Lapdan qapı açıldı.* – [Xavər Kərimxana:] *..Bir dəfə diqqətlə lapdan ona bax!* M.İbrahimov.

**LAP-LAP** *zərf dan*. Təəccüblə, heyrətlə, mat-mat. *Lap-lap baxmaq. – Orada qaynaşan müxtəlif adamları görüb, gözlərini lap-lap döyən Gəray bəyi yenə də nökəri .. ayıltdı*. S.Rəhimov.

**LARI** *sif.* Uzunqıçlı, uzunboğazlı toyuq və xoruz cinsi. [Qız] *eyvanın küncündə ları xoruzun qanadından düşmüş uzun lələyi görüb sevincək götürdü.* M.İbrahimov.

**LARİNGÍT** [*yun*. larunx] *tib*. Qırtlağın selikli qişasının iltihabı.

**LARİNQOLÓGİYA** [*yun.*] Təbabətin boğaz xəstəliklərindən bəhs edən bölməsi. *Larinqologiya qırtlağın fiziologiyasını, patologiyasını, onun xəstəliklərinin müalicə və profilaktika üsullarını öyrənir.*

**LARİNQÓLOQ** [*yun.*] Qulaq, boğaz, burun xəstəlikləri mütəxəssisi olan həkim.

**LARİNQOSKÓP** [*yun.*] Boğazı müayinə etmək üçün uzun dəstəsi olan yastı güzgü şəklində tibb aləti.

**LAS** *təql.* 1. Toyuğu tutmaq istərkən çıxarılan səs. *Las eləyib toyuğu tutmaq*.

2. *sif. məc.* Bacarıqsız, əlindən iş gəlməyən. *Las adam*.

3. *is. məh*. Ot çalınarkən yerə tökülən lay, çalınmış ot layı.

**LAS-LAS** *zərf* Qat-qat, lay-lay, təbəqə-təbəqə. *Otu las-las yığmaq. Torpağı las-las tökmək.*

**LAST** *is.* [*ing.*] Sualtı üzgüçülükdə istifadə edilən xüsusi rezin ayaqlıq.

**LASTİK¹** [*ing.*] Əsasən astarlıq üçün işlədilən parıldayan pambıq parça.

**LASTİK²** [*yun.*] Corabbağı, kəmər və s.-də işlədilən rezin elastik parça. // *Sif. mənasında*. Bu parçadan tikilmiş, hazırlanmış.

*Lastik kəmər. – Qızdırma artdığı zaman başına, ürəyinə kompres, lastik torbada buz qoyurdu.* A.Şaiq.

**LAŞƏ** [*fars.*] bax **leş**. [Molla:] *Əti çox istəyirəm, leyk pulu ondan çox; Nola, quzğun kimi ta müftə qonam laşə, ətə.* M.Ə.Sabir.

**LATAYIR** *sif.* və *zərf dan.* Ədəbsiz, nalayiq, hərzə. *Latayır danışmaq. Latayır demək.* – [Həsən] *kərbəlayını dinc qoymurdu, .. min latayır sözlər ilə borcunu tələb edirdi.* Çəmənzəminli.

**LATINCA** *sif.* və *zərf* Latın dilində. *Latınca yazı.*

**LATINLAR** *is.* İtaliyada Lasiuma vilayətində məskunlaşmış qədim italyan tayfaları; romalılar. *Latınların köhnə məskəni bugünkü İtaliya dövlətidir ki, Apennin yarımadasında bulunur.* F.Ağazadə.

**LATINLAŞDIRMA** "Latınlaşdırmaq"dan *f.is.*

**LATINLAŞDIRMAQ** *f.* 1. Latın mədəniyyətini və dilini tətbiq etmək, yaymaq.

2. Bir əlifbanı latın əlifbası əsasında qurmaq, düzəltmək, yaxud onunla əvəz etmək.

**LATINLAŞMA** "Latınlaşmaq"dan *f.is.*

**LATINLAŞMAQ** *f.* 1. Latın mədəniyyətini və dilini mənimsəmək, qəbul etmək.

2. Latın əlifbası əsasında qurulmaq, yaxud onunla əvəz edilmək (əlifba haqqında).

**LATIŞ** *is.* Latviyanın əsas əhalisini təşkil edən xalq və bu xalqa mənsub adam.

**LATIŞCA** *sif.* və *zərf* Latış dilində. *Latışca yazmaq.*

**LATİFÚNDİYA** [*lat.* latus – geniş və *fundus* – torpaq] İri, xüsusi torpaq mülkiyyəti.

**LATİNİST** Latın dili, latın filologiyası mütəxəssisi.

**LATİNİZM** Latın dilindən alınmış söz və ya ifadə.

**LAT-LÜT** *sif. dan.* 1. Çılpaq, lüt, paltarsız. *Cənab xan əyləşib yatağında, lat-lüt; başında bir .. papaq, ağlayır.* Ə.Haqverdiyev.

2. *məc.* Heç bir şeyi olmayan, yoxsul, kasıb. *Lat-lüt adam.* // İs. mənasında. [Usta Ramazan:] *Nisanın atası dedi ki, mənim latlütə veriləsi qızım yoxdur.* M.Hüseyn. ☐ **Latlüt qalmaq** – hər şeyi əlindən çıxmaq, tamam yoxsullaşmaq, kasıblaşmaq. [Sona xanım:] *Budur, kişi qurşanıb qumara, bir aydan sonra görərsən, olub-qalanının hamısını uduzub qaldı lat-lüt.* Ə.Haqverdiyev.

**LATUN** *is.* [*alm.*] Mis və sinkin qızıl rəngli xəlitəsi.

**LATVİYALI** bax **latış**.

**LAUREÁT** [*lat.* laureatus – dəfnə yarpağı ilə mükafatlandırılmış] Elm, incəsənət, xalq təsərrüfatı və başqa sahələrdəki böyük xidmətlərinə görə xüsusi mükafata layiq görülmüş şəxs. *Dövlət mükafatı laureatı. Pianoçuların Beynəlxalq müsabiqəsi laureatı. Festivalın ilk laureatları müəyyən edilmişdir.*

**LAUREATLIQ** *is.* Laureat olma, laureat adı alma. *Laureatlıq nişanı. Rəssamın ən yaxşı əsəri laureatlığa təqdim edildi.*

**LAÜBALI** *sif.* [*ər.*] Etinasız, saymaz, heç bir şeyə əhəmiyyət verməyən, laqeyd, saygısız, qeydsiz, qayğısız. *Laübalı adam.* – [Mirzə] *şərabı masanın üstünə qoyub, özünə bir laübalı sifət verib aynaya baxdı.* Ə.Haqverdiyev. *Arif laübalı qəhqəhə ilə cibindən bir revolver çıxarır.* H.Cavid.

**LAÜBALILIQ** *is.* Etinasızlıq, saymazlıq, laqeydlik, qeydsizlik, qayğısızlıq. *..İri gövdəli bir adam* [Neməti] *içəri dəvət etdi və sərxoşlara məxsus bir laübalılıq ilə əlini Nemətin çiyninə qoyub, onu dinlədi.* Çəmənzəminli.

**LÁVA** [*ital.*] 1. Vulkanın ağzından çıxan ərgin odlu kütlə.

2. *məc.* Böyük kütlə halında sürətlə hərəkət edən şey haqqında; izdiham. *Qaynar lava kimi; Hərəkətə gəlir; Zavodlar, fabriklər.* R.Rza.

**LAVAŞ** *is.* Nazik yayılmış xəmirdən bişirilən çörək növü: yuxa, yayma. *Ağ lavaş. Lavaşları qatlamaq.* – [Qovurmaçı] *iç qovurmasını lavaşın üstünə çəkərək alıcılara uzadırdı.* M.İbrahimov. ..[Yolçu] *lavaşla pendiri tələsmədən böyük iştaha ilə yeməyə başladı.* S.Rəhman.

**LAVAŞA¹** bax **lavaşana**. [Maral:] *Vaxtında .. lavaşana eləməsələr,* [meyvəni] *yığıbyığışdırmaq olmayacaq.* Ə.Əbülhəsən.

**LAVAŞA²** *is. məh.* Atı nalladıqda ağzına, qulağına keçirilən burmac, tıxac.

**LAVAŞALAMA** "Lavaşalamaq"dan *f.is.*

**LAVAŞALAMAQ** *f. məh.* Atı nallarkən ağzına lavaşa vurmaq. *Atı lavaşalamaq.*

**LAVAŞANA** *is.* Turş giləmeyvə mətindən hazırlanan, xörəyə qatılan turşu növü (adətən lavaş şəklində olur). *Alça lavaşanası. Zoğal lavaşanası. Lavaşana doğramaq.*

**LAVAŞANALIQ** *is.* Lavaşana üçün olan, lavaşanaya yarayan. *Lavaşanalıq alça* (*zoğal*).

**LAVAŞÇI** *is. köhn.* Lavaş bişirib satmaqla məşğul olan adam. // Sif. mənasında. *Lavaşçı dükanına çatanda Mirzə Qulam gülümsəyərək dedi: – Kabab ilə bürüştə lavaşın ayrı ləzzəti olur axı!* Mir Cəlal.

**LAVAŞÇILIQ** *is.* Lavaşçının işi, peşəsi. *Lavaşçılıq etmək.*

**LAVAŞQULAQ** b a x **palazqulaq** 1-ci mənada.

**LAVAŞLAMA** "Lavaşlamaq"dan *f.is.*

**LAVAŞLAMAQ** *f.* Lavaşa bükmək, lavaşın içinə qoymaq. *Halvanı çaldım, həmi lavaşladım; Bir neçə molla qarnını aşladım.* Ə.Nəzmi.

**LAVSÁN** *is.* Sintetik lif növü və ondan toxunmuş parça.

**LAY**[1] 1. *is.* Üfüqi vəziyyətdə bir-birinin üstündə yerləşən cismin sıralarından hər biri; qat. *Torpaq layı. Gil layı. Qumlu laylar.* // Qat-qat görünən, sıx, qalın (bulud, tüstü, duman və s. haqqında). *Toz layları. Duman layları. – Bir yığın bulud layları göyün tən ortasında bir-biri üzərinə qalaqlanmışdı.* Ə.Məmmədxanlı. *..Bağların üzərilə ağ bir duman layı sürünürdü.* İ.Əfəndiyev. *Nəhayətsiz tüstü laylarından, oddan, alovdan başqa, şəhərdə heç nə gözə dəymirdi.* Ə.Əbülhəsən.

2. *sif.* Bütöv, calaqsız, səlt, tam. *Lay divar. Lay dəmir.*

3. "Kimi", "təki" qoşmalarından əvvəl sif. mənasında – boy-buxunlu, gövdəli, hündür, şaqqalı. [Həsən:] *..Cavan, laytək oğlanı vurub yıxdılar yerə.* Ə.Haqverdiyev.

4. Saylardan sonra "cərgə", "sıra" mənasında işlədilir. *İki lay ağac suladıq. – Qəhrəman dəryazı alıb bir lay çiçəkli ot çaldı.* S.Rəhimov.

◊ **Lay bağlamaq** – bir-birinin üstünə yığılmaq, üst-üstə gəlmək. *İllərdən bəri Gülsəhərin ürəyinə yığılıb lay bağlamış, ona rahatlıq verməyən nisgil, iztirab, həyəcan .. kükrəyib daşırdı.* Ə.Vəliyev.

**lay-lay** *zərf* Qat-qat, çin-çin, təbəqə-təbəqə, laylar halında. *Lay-lay yığılmaq. –* [Arvad] *..qutuya lay-lay yığılan əlçimləri cəhrənin yanına itələdi..* Çəmənzəminli. *Ekskavator təpələri lay-lay açıb, lay-lay qazır; Qoca alim saxsı yığıb, yer altından tarix yazır.* S.Vurğun. // *Sif. mənasında*. Qatlar, təbəqələr halında olan. *Lay-lay buludlar.*

**LAY**[2] *is.* Açılıb-örtülən şeyin (qapının, pəncərənin) tərəflərindən hər biri; tay. *Qapının bir layını açmaq. Pəncərənin laylarını örtmək.*

**lay-lay** b a x **laybalay**[2]. *Açıldı qapılar önündə lay-lay.* Z.Xəlil.

**LAYARASI** *sif.* Layların arasında yerləşən. *Layarası su.*

**LAYBALAY**[1] *zərf* 1. Laylar halında, qat-qat, üst-üstə, çin-çin. *Laybalay yığmaq. Laybalay tökmək. – Onda, görürsən, yıxılıb yanbayan; Bir neçə növrəstə cavan laybalay.* M.Ə.Sabir. // Məc. mənada. [Qaçay:] *Nə vaxta kimi sözlər ürəyimdə laybalay yığılıb qalacaq?* Ə.Vəliyev.

2. Laylar üzrə, hər bir layı ayrılıqda. *Quyunu laybalay yumaq.*

**LAYBALAY**[2] *sif.* və *zərf* Hər iki tayı, taybatay. *Qapı laybalay açıldı. – Bir azdan taxta darvaza laybalay açıldı.* Q.İlkin.

**LAYDIR** *is.* Kotanın torpağı çevirən hissəsi.

**LAYƏMUT** *sif.* [*ər.*] *klas*. Ölməz, əbədi.

**LAYİHƏ** *is.* [*ər.*] 1. Tikiləcək, qurulacaq, yaradılacaq bir şeyin əvvəlcədən düşünülüb hazırlanmış, işlənmiş planı; proyekt. *Tikintinin layihəsi. Maşının layihəsi. Körpünün layihəsi. – Qara daşlarda qoyulacaq ilk kəşfiyyat buruqlarının layihəsi Moskvada təsdiq olunmuşdu*. M.Hüseyn. [Reyhan:] *Təzə layihə haqqında səninlə danışmaq istəyirəm.* İ.Əfəndiyev. *Tikintinin layihə və smetası dövlət tərəfindən təsdiq edilmişdir*. M.Rzaquluzadə.

2. Hər hansı bir sənədin, qərarın və s.-nin əvvəlcədən yazılmış təxmini mətni. *Qərarın layihəsini hazırlamaq. Nizamnamənin layihəsi. Müqavilənin layihəsi.*

3. *məc.* Nəzərdə tutulmuş niyyət, fikir mənasında. [İlyas:] *Sən görürsən ki, Qızıl Arslanın tabutu aralıqdan qaldırılmadan iraqlılar məmləkəti bölüşdürmək üçün layihə*

*düzəldirlər*. M.S.Ordubadi. *Gəldiyevi belə bir tədbirə vadar eləyən o idi ki, şəxsən özü layihə düzəltmək niyyətində idi*. Mir Cəlal. [Həmzə] *şəhərdə şəriki ilə bu planı həyata keçirmək üçün konkret layihə də hazırlamış*(*dı*). Ə.Əbülhəsən.

**LAYİHƏÇİ** *is.* Layihələşdirmə mütəxəssisi, layihə çəkən, layihə tərtib edən; proyektçi. – [Bənna:] *Layihəçilər nə verib, biz də onun əsasında tikmişik*. Mir Cəlal.

**LAYİHƏLƏNDİRİLMƏ** "Layihələndirilmək"dən *f.is.*

**LAYİHƏLƏNDİRİLMƏK** *məch.* Layihəsi tutulmaq, layihəsi tərtib olunmaq. *Yeni zavod layihələndirildi.*

**LAYİHƏLƏNDİRMƏ** "Layihələndirmək"-dən *f.is. Layihələndirmə işləri*.

**LAYİHƏLƏNDİRMƏK** *f.* 1. Bir tikinti, qurğu və s.-nin layihəsini tərtib etmək, hazırlamaq.

2. *məc.* Nəzərdə tutmaq, təxmin etmək. *İdman kompleksi tikilişini layihələndirmək*.

**LAYİHƏLƏNMƏ** "Layihələnmək"dən *f.is.*

**LAYİHƏLƏNMƏK** *f.* Tikintinin, qurğunun layihəsi hazırlanmaq, layihəsi tərtib edilmək.

**LAYİHƏLƏŞDİRİLMƏ** "Layihələşdirilmək"dən *f.is.*

**LAYİHƏLƏŞDİRİLMƏK** b a x **layihələndirilmək**. *Yeni yaşayış binaları layihələşdirildi*.

**LAYİHƏLƏŞDİRMƏ** "Layihələşdirmək"-dən *f.is.*

**LAYİHƏLƏŞDİRMƏK** b a x **layihələndirmək**. *Üçüncü mərtəbəni layihələşdirmək istəmədilər.* Mir Cəlal. [Əlikram Səlimə:] *Bilirsən ki, dənizə çıxan köndələn küçədəki beşmərtəbəli binanı .. layihələşdirdim.* B.Bayramov.

**LAYİQ** *sif.* [*ər.*] 1. Münasib, yaraşan. *Bu paltar sənə layiq deyil. – İgidlik iddiasın edənə layiq deyil yalan.* M.P.Vaqif. *Sənə layiq deyil, Seyyid, dəxi məşuqəbaz olmaq*. S.Ə.Şirvani. [Məşədi İbad:] *Zarafat deyildir, bir ətək pul verirəm, .. mənim istədiyim odur ki, özümə layiq arvad olsun*. Ü.Hacıbəyov. □ **Layiq bilmək (görmək)** – münasib bilmək (görmək), yaraşdırmaq. *Yadlar ilə danışmaya, gülməyə; Hər sözü şəninə layiq bilməyə..* Q.Zakir. [Fəxrəddin] *bir təhlükə hiss etsə belə, qorxaqlığı öz qəhrəmanlığına layiq bilmirdi*. M.S.Ordubadi. **Layiq görülmək** – bir şeyə layiq olduğu qəbul edilmək, layiq hesab edilmək. *Mükafata layiq görülmək. Tərifə layiq görülmək. – Çəmbərəkənd böyük bir şəhərin içərisində yoxsullara layiq görülmüş bir kənd idi.* S.Rəhman. // *köhn*. İzafət birləşmələrinin birinci tərəfi kimi işlənir; məs.: layiqi-təhsin (alqışlanmağa layiq), layiqi-tərif (tərifə layiq) və s. [Humay:] *Bu hal, əsla şayani-mərhəmət deyil, olsa-olsa ancaq layiqi-nifrət ola bilər.* H.Cavid. *Sənəti-şeir ilə, Vahid, sən də göstər bir hünər; Layiqi-təhsin deyil kim ki, sənətkar olmasa*. Ə.Vahid.

2. **Layiqlə** şəklində – b a x **layiqincə**.

**LAYİQİ** [*ər.*] b a x **layiqli**. [Məcid] *özündən vəzifəcə böyük olan Mədədin yanında özünü layiqi surətdə aparmaq istəyirdi.* S.Rəhimov.

**LAYİQİNCƏ** *zərf* Lazım olduğu kimi, necə lazımsa, münasib şəkildə; ləyaqətlə, layiqli. *Layiqincə qulluq etmək. Layiqincə qarşılamaq. – Rəsul atasını layiqincə dəfn etdikdən sonra başladı ehsan verməyə.* "Aşıq Qərib". *Molla Tanrıverdi də arvadı ilə amadə oldular ki, əziz qonağı layiqincə qəbul etsinlər*. E.Sultanov. // Lazımi qaydada, tələb olunduğu kimi, istənilən kimi. *Heç bir işimiz rövnəq tapmayıbdır, layiqincə nizam və qaydaya düşməyibdir.* F.Köçərli. // Lazımi kimi; yaxşı. *Telli eşidirdi, fəqət səs aydın gəlmədiyindən layiqincə anlamayırdı*. S.Hüseyn.

**LAYİQLİ** *sif.* Münasib, yaxşı, ləyaqətli. *Layiqli geyim. Layiqli süfrə açmaq*. — *Bir elə layiqli kələk qurmayır; Gəncədə derlərsə vurur, vurmayır; Oylə ki, Səlyanda vurur tək səbir.* M.Ə.Sabir.

**LAYİQLİLİK** *is.* Layiq olma; ləyaqətlilik, ləyaqət. // Münasiblik.

**LAYİQSİZ** *sif.* Layiq olmayan, münasib olmayan; yaraşmayan, ləyaqətsiz, nalayiq, pis. *Layiqsiz söz demək. Layiqsiz yer tutmaq.*

**LAYİQSİZLİK** *is.* Ləyaqətsizlik, nalayiqlik, münasibsizlik.

**LAYKA** *is.* [*rus.*] İncə və yumşaq dəri və həmin dəridən tikilmiş paltar (palto, pencək, gödəkcə).

**LAYLA(Y)** *is.* 1. Körpə uşaqları yatırtmaq üçün hava ilə oxunan həzin şeir parçası; nənni,

beşik nəğməsi. *Laylay çalmaq. Laylay demək. Laylay oxumaq. – Oturmuş ana; Basmış bağrına; Nazlı körpəsin; Layla der ona.* A.Səhhət. *Gecə-gündüz gözlərilə çəkmiş mənim keşiyimi; Laylay deyib yırğalamış iftixarla beşiyimi*. S.Rüstəm.

2. Azərbaycan şifahi xalq ədəbiyyatında şeir formalarından biri (çox zaman dörd misrasından 1, 2 və 4-cü həmqafiyə, 3-cü isə sərbəst olur); məs.: *Laylay dedim yatasan; Qızılgülə batasan; Qızılgüllər içində; Şirin yuxu tapasan.*

◊ **Layla demək** *məc.* – arxayınlaşdırmaq, arxayın salmaq, qəflətdə saxlamaq.

**LAYLAMA** "Laylamaq"dan *f.is.*

**LAYLAMAQ** *f.* Lay-lay düzmək, qat-qat qoymaq. *Otu qurumaq üçün laylamaq. Odunu laylamaq*.

**LAYLANDIRMA** "Laylandırmaq"dan *f.is.*

**LAYLANDIRMAQ** *f.* Laylara ayırmaq, laylay etmək, qat-qat düzmək.

**LAYLANMA** "Laylanmaq"dan *f.is.*

**LAYLANMAQ** *qayıd*. Laylara ayrılmaq, lay-lay olmaq. *Süxurlar laylanıb*.

**LAYLAŞMA** "Laylaşmaq"dan *f.is.*

**LAYLAŞMAQ** b a x **laylanmaq**.

**LAYLI** *sif.* Laylardan ibarət, lay şəklində yığılmış; qat-qat, təbəqə-təbəqə, lay-lay. *Laylı süxurlar*.

**LÁYNER** *is.* [*ing.*] Müntəzəm olaraq uzaq səfərlərə çıxan iri və sürətli nəqliyyat gəmisi.

**LAZ** Abxaziya, Acarıstan və Türkiyədə yaşayan Cənubi Qafqaz xalqlarından biri və bu xalqa mənsub adam.

**LAZARET** *is.* [*ital.*] Hərbi hissələrdə təşkil olunmuş müalicə məntəqəsi.

**LAZCA** *sif.* və *zərf* Laz dilində. *Lazca mahnı. Lazca danışmaq*.

**LÁZER** *is.* [*ing.*] Optik kvant generatoru.

**LAZIM** *sif.* [*ər.*] 1. Mütləq gərək olan, onsuz keçinmək mümkün olmayan; gərəkli, lüzumlu, vacib, zəruri. □ **Lazım bilmək (görmək)** – yerinə yetirilməsini vacib saymaq, zəruri bilmək. *Xanla Vaqif uzun-uzadı məsləhətləşib yenə bəzi tədbirlər görülməsini lazım bildilər*. Çəmənzəminli. *Rüstəm kişi rayonun rəhbər təşkilatları ilə mübahisə etməyi lazım bilmədi.* M.İbrahimov. [Əfruz bacı] *Mədədin öz ayağı ilə* [Sübhanverdizadəyə] *baş çəkməyini lazım gördü*. S.Rəhimov. **Lazım gəlmək** – vacib olmaq; zəruri olmaq, məcburi olmaq, ehtiyac olmaq. [Müəllim] *hiss etdi ki, belə mühüm bir məsələni Telli kimi avam bir qadına qandırmaq üçün əsaslı dəlillər və sübutlar lazım gələcəkdir*. S.Hüseyn. *Molla Sadığı da yuxudan oyatmaq lazım gəlmədi, səs eşidən kimi özü həyətə çıxdı.* İ.Şıxlı. **Lazım olmaq** – gərək olmaq, işə yaramaq. [Gülçöhrə:] *Sənə lazım olmaz, amma Telliyə lazım olar.* Ü.Hacıbəyov.

2. Xəbər şəkilçisi ilə: **lazımdır** – gərəkdir, vacibdir, ehtiyac hiss olunur. *Lazımdır mikrobları millətin bədənindən kənar eləmək.* C.Məmmədquluzadə. [Birinci fəhlə:] *Bu saat tətil etmək lazımdır*. H.Nəzərli. [Bəhlul:] *Durmaq, məsləhət eləmək vaxtı deyildir, o taya addamaq lazımdır.* Ə.Vəliyev.

◊ **Lazım şəkli** *qram*. – felin iş və ya hərəkətin icra edilməsinin lazım olduğunu bildirən şəkli; məs.: başlanasıdır, qalasıyam, yazası imiş, gələsi idik və s.

**LAZIMINCA** *zərf* İstənilən qədər, kifayət qədər, kafi dərəcədə, lazımi dərəcədə, lazımi surətdə. *Məktubda bir-iki kəlmə söz var ki, mətləbi lazımınca kəşf edir.* C.Məmmədquluzadə. *Çöllərdəki yaşıl əkinlər lazımınca boy atmadan təravətdən düşürdü.* S.Hüseyn. *Bəhram şəhərdəki İran konsulxanasında katiblik edirdi. Lakin bu vəzifə onu lazımınca təmin etməyirdi*. Çəmənzəminli. // *dan*. O ki var. *Onu lazımınca əzişdirdilər.*

**LAZIMİ** *sif.* [*ər.*] 1. Yerinə yetirilməsi vacib və lazım olan; zəruri, gərəkli, lüzumlu. *Lazımi tapşırıqlar verildi. Lazımi ehtiyat.*

2. Münasib, uyğun, istənilən kimi. *Lazımi dərəcədə şərh etmək. Lazımi qaydada geyinmək.*

3. Lazım olan, tələb olunan, istənilən. *Lazımi məbləğ. Lazımi sənəd. – Məzlum .. ev yiyəsindən lazımi ünvanı aldıqdan sonra, onu möhkəm qucaqlayıb ayrıldı..* S.Vəliyev.

**LAZIMLI** *sif.* Yararlı, gərəkli, faydalı; vacib, zəruri. *Lazımlı şey*. – [Kitabpaylayan:] *O qədər lazımlı kitablar var ki, üstünü toz basa-basa qalıb bu şkaflarda*. Ə.Haqverdiyev.

**LAZIMLIQ** *is.* Lazım olma; gərəklik, zərurilik, vaciblik.

**LAZIMSIZ** *sif.* Lazım olmayan, gərəksiz, lüzumsuz. *Lazımsız material. Lazımsız şeylər. – Fəhlələr mərasim zamanı lazımsız münaqişəyə yol verməmək üçün orkestri buraxdılar.* M.Hüseyn. [Hakim] *səliqəli stolunun üstündə gördüyü lazımsız kağızları bir-bir cırıb səbətə atırdı.* Mir Cəlal. // Artıq, izafi, lüzumsuz, faydasız. *Lazımsız məxaric.* – [Hacı Bayram:] *Ancaq lazımsız xərcdir, çünki bu hökumət beşgünlükdür.* Ə.Haqverdiyev.

**LAZIMSIZLIQ** *is.* Lazım olmama; gərəksizlik, lüzumsuzluq.

**LEGİÓN** [*lat.*] 1. *tar.* Qədim Romada: iri qoşun hissəsi.

2. Bəzi ölkələrdə xüsusi qoşun hissələrinin adı.

**LEGİONÇU** *is.* Legionda xidmət edən əsgər.

**LEHİM** *is.* [*ər.*] Metal şeyləri yapışdırmaq üçün qalay və s. ərinti.

**LEHİMÇİ** *is.* Lehimləmə ustası.

**LEHİMLƏMƏ** "Lehimləmək"dən *f.is.*

**LEHİMLƏMƏK** *f.* Lehim vurmaq, lehimlə birləşdirmək. *Boruları lehimləmək.* // Mis və başqa qablardakı dəlikləri lehimlə tutmaq, lehimləmək. – [Sərvnaz qarı:] *Eşitdim ki, qalayçı Əliş gələcək bura. Dedim bəlkə körük qurdu, verim, deşiyi lehimləsin.* B.Bayramov.

**LEHİMLƏNMƏ** "Lehimlənmək"dən *f.is.*

**LEHİMLƏNMƏK** *məch.* Lehim vurulmaq, qalay və s. ilə yapışdırılmaq (tutulmaq). *Qazan lehimləndi.*

**LEHİMLƏTMƏ** "Lehimlətmək"dən *f.is.*

**LEHİMLƏTMƏK** *f.* Lehim vurdurmaq, qalay və s. ilə yapışdırtmaq (birləşdirtmək). *Samovarı lehimlətmək.*

**LEHİMLƏYİCİ** *sif.* Lehimləyən, lehimləmə üçün olan. *Lehimləyici ərinti. Lehimləyici lampa.* // *İs. mənasında.* Lehimləyən alət. *Lehimləyicini təmir etmək.*

**LEHİMLİ** *sif.* Lehim vurulmuş, lehimlənmiş, qalay və s. ilə yapışdırılmış. *Lehimli çaynik.*

**LEHİNƏ** *zərf* [*ər.*] Xeyrinə, tərəfinə, mənfəətinə (*əleyhinə* ziddi). *Lehinə səs vermək. Lehinə çıxmaq. – Vəziyyət hər tərəfdən Qızıl Arslanın lehinədir.* M.S.Ordubadi. *Bəzi kəndlilərə də kimin lehinə, kimin əleyhinə əl qaldırmağı başa salmaq çətin idi.* Mir Cəlal.

**LEHLƏR** Polyakların köhnə adı.

**LEHMƏ** *is.* Duru palçıq, batdaq. *Lehməyə batmaq. Cavad yoldaşları ilə birlikdə xirtdəyə kimi lehməyə bataraq qalın meşələrdən keçir, .. hədəfə doğru irəliləyirdi.* Ə.Vəliyev.

◊ **Lehməsi axmaq** – çox çirkli, kirli adam haqqında. *Uşağın lehməsi axır.*

**LEHMƏLİ** *sif.* Lehmə qatışıq, palçıqlı. *Lehməli su. – Çöldən uzanıb gələn köhnə arxın bulanıq, lehməli suyu taxılı basaraq gölməçələnirdi.* M.İbrahimov. *Bu Lökbatan bir düzəndi, üstü lehməli; Onu abad etdi azad insanın əli.* R.Rza.

**LEHMƏQARIN** *sif. dan.* Qabağına gələni yeyən, çox yeyən, yeməkdən doymayan. *Lehməqarın adam.*

**LEHMƏLİK** *is.* Lehmə yığılmış yer; palçıqlıq, batdaq. [Gecə] *düz aşağıdakı lehməliyə düşmüşdü və o dəqiqədə lehməlik onu udmuşdu.* Ə.Məmmədxanlı.

**LEK** Albaniya Xalq Respublikasında pul vahidi.

**LEKÁL** [*rus.* лекало] Əyri cizgiləri çəkmək üçün fiqurlu xətkeş.

**LEKSÉM** *is.* [*yun.*] Dilçiliyin leksikologiya şöbəsinin vahidi; söz.

**LEKSİK** *sif. dilç.* [*yun.*] Leksikaya aid olan, lüğəvi. *Sözün leksik mənası. Dilin leksik sərvəti.*

**LÉKSİKA** [*yun.*] Hər hansı bir dildə və ya dialektdə işlədilən sözlərin məcmusu. *Azərbaycan dilinin leksikası.* // Hər hansı bir yazıçının əsərinin lüğət tərkibi. *Füzulinin leksikası. Vaqifin leksikası. M.F.Axundzadənin leksikası.*

**LEKSİKÓQRAF** [*yun.*] b a x **lüğətçi**.

**LEKSİKOQRÁFİYA** [*yun.* lexikos – söz və logos – yazıram] b a x **lüğətçilik**.

**LEKSİKOLÓGİYA** [*yun.* lexikos – söz və logos – nəzəriyyə] Dilçiliyin dilin lüğət tərkibini öyrənən bəhsi; lüğətşünaslıq.

**LEKSİKÓLOQ** [*yun.*] Leksikologiya mütəxəssisi; lüğətşünas.

**LÉKSİYA** [*lat.*] b a x **mühazirə**. *Bu qayda ilə polis darülfünuna gəlib leksiyalarda iştirak etməyənləri bəlli etmək istəyirdi.* T.Ş.Simurq. *Soltan Əmirli sənin kimi illərlə məktəb skamyasında leksiya dinləməyib.* İ.Hüseynov. **Leksiya oxumaq** *məc.* – öyüd, nəsihət vermək.

[Rüstəm bəy:] *..Azarlı .. can verir. Sən burada bizə leksiya oxuyursan.* S.S.Axundov. *Mən gəmidə düz bir saat bu barədə əsgərə leksiya oxumuşam və sənə də məsləhət görürəm ki, bu saat onu belindən aç, başına qoy.* Ə.Əbülhəsən.

**LÉKTOR** [*lat.* lector – oxuyan] Auditoriya qarşısında leksiya oxuyan şəxs; mühazirəçi. *Afərin deyərəm o lektora ki,* [Hacının adamına] *kafirdir desin.* Qantəmir.

**LEKTORİYA** [*lat.*] Kütləvi mühazirələr keçirilən yer (zal, bina).

**LEQAL** [*lat.*] Qanuni, qanunla icazə (yol) verilən, açıq (*qeyri-leqal* əksi). *Leqal ədəbiyyat. Leqal qəzet. Leqal vəziyyət.*

**LEQALLAŞDIRILMA** "Leqallaşdırılmaq"-dan *f.is.*

**LEQALLAŞDIRILMAQ** *məch.* Leqal vəziyyətə gətirdilmək, leqal şəklə salınmaq, gizli vəziyyətdən açıq vəziyyətə keçirilmək, qanunla yol verilmək.

**LEQALLAŞDIRMA** "Leqallaşdırmaq"dan *f.is.*

**LEQALLAŞDIRMAQ** *f.* Leqal vəziyyətə gətirmək, leqal şəklə salmaq, gizli vəziyyətdən açıq vəziyyətə keçirmək, qanuni olduğu qəbul edilmək. *Mətbuatı leqallaşdırmaq.*

**LEQALLAŞMA** "Leqallaşmaq"dan *f.is.*

**LEQALLAŞMAQ** *f.* Leqal vəziyyətə keçmək, leqal şəkil almaq, gizli vəziyyətdən açıq vəziyyətə keçmək.

**LEQALLIQ** *is.* Leqal vəziyyətdə olma; qanunla yol verilmə, qanuni olma; açıqlıq, aşkarlıq (*qeyri-leqallıq* əksi).

**LÉMMA** [*yun.*] *riyaz.* Bir və ya bir neçə teoremi sübut etmək üçün lazım olan köməkçi teorem.

**LEMUR** *is.* [*lat.*] Qədim təsəvvürlərə görə əcdadların ruhu.

**LEN** *is.* [*alm.*] Orta əsrlərdə Almaniyada hər bir şəxsə hərbi və ya inzibati xidmət müqabilində bağışlanan torpaq sahəsi.

**LEND-LİZ** [*ing.*] İkinci dünya müharibəsi zamanı ABŞ-ın borc olaraq müttəfiq dövlətlərə silah, xammal, ərzaq və s. mallar vermə sistemi.

**LENT** *is.* [*alm.*] 1. Bəzək və s. üçün işlədilən dar, uzun parça zolağı. *Sarı lent. Ağ lent. Qara lent. – "Ura" səsləri altında qırmızı lent kəsildi, stansiya işə salındı.* M.İbrahimov. *Gör qızların saçlarında; Necə ipək lentləri var!* M.Dilbazi. *Gördüm təyyarə meydanında sıralanıb; uzaq səfərli neçə-neçə; Gümüş rəngli insan tabutu; Üstündə lent – qara atlaz.* R.Rza.

2. Orden və medal üçün müəyyən rəngdə və ölçüdə ipək zolaqcıq. *Döşünə cərgə ilə orden və medal lentləri taxmış ortaboylu, kök, qoca kapitan nəvəsini qucaqladı.* M.Süleymanov.

3. Müxtəlif materialdan kəsilmiş uzun, ensiz zolaq. *Kağız lent. Teleqraf lenti. İzolyasiya lenti.* // Bəzi nəqliyyat qurğularında, mexanizmlərdə intəhasız hərəkət edən parça zolağı. *Konveyer lenti. Transportyor lenti.*

4. *məc.* Ensiz, zolaq kimi uzanıb gedən, nəhayəti görünməyən. *Yol getdikcə sarı bir lent kimi uzanırdı. – Yol gah lent kimi dərələrdən, gah da dağlardan keçirdi.* Ə.Məmmədxanlı. *Hər yan dəniz, yol ortadan: Lent kimi uzanırdı.* M.Dilbazi.

◊ **Kinematoqrafiya lenti** – üzərinə həssas emulsiya çəkilmiş şəffaf, lentəoxşar plyonka. **Maqnit lenti** – qeyri-maqnit əsaslı elastik lentdən ibarət informasiya daşıyıcısı. *Qayalar səsimi yazdı lentinə; Qaya maqnitafon dilləndi yenə; "Hey, hey! Bir dayan; Şövkətdir oxuyan, Habildir çalan!.."* M.Araz. **Pulemyot lenti** – pulemyot patronlarını qoymaq üçün yuvacıqları olan ikiüzlü parusin zolaq. *Pulemyot lentini doldurmaq.*

**LENTƏBƏNZƏR** *sif.* Şəkilcə lentə oxşayan; lentvari. *Lentəbənzər qurdlar.*

**LENTLİ** *sif.* Lenti olan, lentlə bəzədilmiş, lent tax(ıl)mış. *Lentli saç. Lentli qutu. – Şəkildə lentli, kök, qaragöz bir qız uşağı oturub kitab oxuyurdu.* Mir Cəlal.

**LENTVARİ** *sif.* Lentə bənzəyən, lentəoxşar, zolaq şəkilli, lent kimi. *Lentvari yol.*

**LEONİD** *is.* [*lat.*] Səmada Şir bürcündə özünü göstərən meteor seli (cəmdə işlənir: **leonidlər**).

**LEŞ** *is.* [*fars.*] 1. Ölmüş heyvan bədəni, leş, cəmdək. *İt leşi. İnək leşi. – Yolun ətrafında sınıq düşmən maşınları, at leşi və əzilmiş toplardan başqa bir şey gözə dəymir.* Ə.Vəliyev. *Məşədi Heybət bizə nişan verirdi: bu qoyun leşidir, bu təknədir, bu sandıqdır, bu beşikdir.* Ə.Sadıq.

2. Təhqir kimi insan meyiti haqqında işlənir. *Döyməsin qanlı faşistlər daha öz döşlərinə; Baxsalar yaxşı olar cəbhədəki leşlərinə*. S.Rüstəm. *Tökülürdü yağış kimi baş bir yana, leş bir yana; Dağılırdı düşmən səfi on bir yana, beş bir yana!* R.Rza.

◊ **Qarğa-quzğun leşə gələn kimi** – çox həris bir şəkildə, tez üstünə cumaraq. *Bakı neft yataqları xariciləri özünə çəkirdi, qarğa-quzğun leşə gələn kimi əcnəbi kapitalistləri də Azərbaycana dolurdu*(*lar*). M.İbrahimov.

**leş-leşə: leş-leşə söykənmək, qalanmaq** və i.a. – yan-yana yıxılmış çoxlu meyit haqqında. *Başlar qopub düşdü qanlı torpağa; Leş-leşə qalandı, yollar kəsildi*. M.Rahim. **Leş-leşə qatmaq (çatmaq)** – qırıb çatmaq, qırıb tökmək. *Padşaha xəbər getdi ki, padşah sağ olsun, bir qara atlı oğlan düşməni qırıb leş-leşə çatdı.* (Nağıl).

**LEŞSÖKƏN** *sif.* "Acgöz", "qarınqulu", "doymaz" mənasında. *Bəyəm bu leşsökən, qarın Fərəc Allahı tanıyır?* S.Rəhimov.

**LEŞYEYƏN** *sif.* Ölü heyvan cəmdəklərini yeməklə dolanan. *Leşyeyən quş*.

**LEY** *is.* Qısadimdik, alıcı – yırtıcı quş. *Ley vuran oldu, mənim kimi tükü dağılan olmadı*. (Ata. sözü). *Birdən xəzəl kimi qopur yerdən; Küləyə qoşulub qaçır; Tükünü ley dağıtmış; Boz bir quş olub qaçır*. R.Rza. *Səməndər leydən qorxmuş sərçə kimi qımıldanmadı*. B.Bayramov. □ **Ley kimi** – çox cəld, çox sürətlə, çox iti. [Həmzə] *bir də diqqət eləyəndə gördü, budu Koroğlu Qıratın üstündə elə gəlir, elə gəlir ki, ley kimi*. "Koroğlu". [Nazlı:] *Dayan! Bu saat bir qıy vurram, Mustafa ley kimi başının üstün alar*. Ə.Məmmədxanlı.

**LEYBORİST** [*ing.*] Siyasətdə reformist mövqedə duran İngiltərə fəhlə partiyası və bu partiyanın üzvü. *Leyborist partiyası. Leyborist hökuməti*.

**LEYK** [*ər.*] *klas*. b a x **lakin**. *Leyk mənim qışda dəxi yaz kimi; Yaşıl olur paltarım ətləs kimi.* M.Ə.Sabir. *Leyk mən vermədim ona fürsət; Onu vurmaqda eylədim sibqət*. A.Səhhət.

**LÉYKA** [*alm*. Leica – Leitz-Camera firmasının adının ixtisarı] *köhn*. Dar plyonkalı kiçik fotoaparat. *..Müxbir leykasını çıxarıb işə saldı*. Ə.Məmmədxanlı.

**LEYKEMÍYA** [*yun*. leukos – ağ və haima – qan] Qanda leykositlərin (ağ qan kürəciklərinin) həddindən çox artması nəticəsində əmələ gələn qan xəstəliyi; ağqanlılıq.

**LEYKOPLASTIR** *is.* [*rus*.] Üstü yapışqanlı yastı tibbi lent.

**LEYKOSİT** [*yun*. leukos – ağ və kytos – hüceyrə] Qanın rəngsiz kürəciklər şəklində olan hüceyrələri; ağ qan cisimcikləri.

**LEYKÓZ** *is.* [*yun*.] Qanyaradan toxumanın pisxassəli şiş xəstəliyi.

**LEYL** *is.* [*ər.*] *klas*. Gecə.

**LEYLAC** *sif.* və *is. dan*. *köhn*. Qumar oynamaqda ad çıxarmış, məşhur qumarbaz.

**LEYLACI** b a x **qıyqacı**. *Aşıq Cünun* [gözələ] *bir leylacı nəzər saldı*. "Koroğlu".

**LEYLƏK** *dan*. Hacıleylək. *Dəmirçinin ömrü taq-taqla, leyləyin ömrü laq-laqla keçər*. (Ata. sözü). *..İlk baharın uğurlu elçiləri olan qaranquş, sığırçın və leylək sürü-sürü dönüb yuvalarını tikəcək*. A.Şaiq.

**LEYLİ** *sif.* [*ər.*] *klas*. 1. Gecəyə məxsus, gecə vaqe olan.

2. Əvvəllər şagirdlərin həm oxuduqları, həm də gecə qaldıqları məktəb; internat. *Eyni zamanda üst mərtəbədə bir müxtəsər leyli məktəbi əmələ gətirmişik*. C.Məmmədquluzadə.

**LEYSAN** b a x **niysan**. *Leysan yağışından sonra Fatma ana göydə hanasını, anam da eyvanda sacını asmışdı*. S.Rəhimov. *..Birdən leysan yağış başlayır*. H.Seyidbəyli.

**LEYTENÁNT** [*fr*.] Ordu və donanmada: kiçik leytenant rütbəsindən sonra gələn zabit rütbəsi və belə rütbəsi olan şəxs. *Bir saat sonra qərargahdan qırmızısifət bir leytenant gəldi*. Mir Cəlal. *Dilaranın leytenant Əjdərdən aldığı məktubların arası kəsilmişdi.* Ə.Məmmədxanlı. □ **Baş leytenant** – leytenant rütbəsindən sonra gələn zabit rütbəsi və belə rütbəsi olan şəxs. **Kiçik leytenant** – praporşikdən sonra gələn zabit rütbəsi və belə rütbəsi olan şəxs.

**LEYTENANTLIQ** *is.* Leytenant rütbəsində olma.

**LEYTMOTÍV** [*alm.*] 1. Musiqi əsərində dönə-dönə təkrar olunan əsas motiv, əsas mövzu. [Uvertüralarda] *kompozitor .. leytmotivlərdən istifadə edərək əsərin dramatik*

*inkişafını simfonik orkestr dili ilə nəql edir.* Ə.Bədəlbəyli.

2. *məc.* Əsərin ana xəttini təşkil edən əsas fikir, müddəa. *Romanın leytmotivi.*

**LƏB** *is.* [*fars.*] *klas. şair.* Dodaq. *Hər zaman düşəndə ləbləri yada; Tökülür gözümdən qanlar, əfəndi!* M.P.Vaqif. *Ver şəfa ləbindən, yazığam, mənə; Zəhri-fərağında ağulanmışam.* Q.Zakir. ◻ **Ləb tərpətmək** – dodaq tərpətmək; dinmək, danışmaq. *Dedilər ki, Təbrizdə çox babı var, amma heç kəs qorxusundan ləb tərpədə bilmir.* M.F.Axundzadə.

**LƏBALƏB** [*fars.*] bax **ləbələb**. *Adını arif qoyubsan, yox cibində bir qəpik; Bax, ləbaləbdir qızıl, kağız cibişdanım mənim.* Ə.Nəzmi. [Vahid:] *Coşqun dağ selləri ilə ləbaləb daşan Kürün, Arazın sahillərini dolaşıb, Alazan çayı boyunca gəzdik.* B.Bayramov.

**LƏBBADƏ** *is.* [*ər.*] 1. *köhn.* bax **aba**[1]. [Molla Xəlil] *uzun ləbbadəsinin ətəklərini yelləndirə-yelləndirə o baş-bu başa gəzinir, qalın bir qaranlığa bürünən kəndə baxırdı.* S.Hüseyn. [Axund] *qara gecə ləbbadəsini ehmalca çiyninə salıb, dəhlizə çıxdı.* Mir Cəlal.

2. *məc.* Uzun, enli, biçimsiz paltar haqqında. *Əynindəki palto deyil, ləbbadədir.*

**LƏBBEYK** [*ər.*] Əslində "nə əmriniz var?", "əmrinizə müntəzirəm", "buyurun!" demək olub, adətən "demək" feli ilə işlənir. *İndi mən tək yeddi yaşında müsəlman uşaqları gərək səhərdən axşama tək ləbbeyk deyib, susuzluqdan od tutub yana.* C.Məmmədquluzadə. [Qürbət xala:] *Necə haradan, səhərdən axşamacan burda ləbbeyk deyirəm, necə ola ki, bilməyəm.* Mir Cəlal. [Zeynal və Veysin] *dostluqları, təbiətlərinin uyğun olması, sadəcə bir-birinə ləbbeyk deməlırindən ibarət deyildi.* Ə.Əbülhəsən.

**LƏBBEYKDEYƏN** *is.* Öz fikri olmayıb başqasının sözü, fikri, göstərişi ilə hərəkət edən adam. [Comərd Sadiqiyə:] *Ağaların, bəy-xanların və onların sözünə sizin kimi ləbbeykdeyənlərin millətlə heç bir əlaqəsi yoxdur.* Ə.Abasov.

**LƏBƏLƏB** *zərf* [*fars.*] Ağzına qədər dolu, tamam dolu, ağızbaağız, malamal, ağız-ağıza. *Küçə ilə bir gün keçərkən, mat və məəttəl qaldım: bir böyük imarət kəndli qadınları ilə ləbələb dolu idi.* C.Məmmədquluzadə.

**LƏBLƏBİ** *is.* Çərəz kimi yeyilən qovrulmuş qabıqsız noxud. *Əkdiyim noxud, biçdiyim noxud, bazara girib, ləbləbi olub.* (Məsəl). [Yanındakı adam:] *Ay usta, yadına ləbləbi düşdü, nədi?* Çəmənzəminli. *Süfrədə tut qurusu, miyanpur, innab, ləbləbi, kişmiş, səbzə, alma, portağal olardı.* H.Sarabski.

**LƏBLƏBİÇİ** *is. köhn.* Ləbləbi qovurub satan adam. *Qəzetçi, inteligent, milyoner, ziyalı, filan; Kababçı, ləbləbiçi ortada-arada qalan!* C.Cabbarlı.

**LƏC** *sif.* [*ər.*] Tərs, höcət, inad. ◻ **Ləc düşmək** – bax **ləcləşmək**. *..Kişi arvadına deyir: – Ay arvad, heç qəm eyləmə, nə qədər canım sağdır, hər günün xərcin qazanacağam. Amma, deyəsən, şah mənimlə ləc düşmüşdür.* (Nağıl). **Ləc salmaq** – iki adam arasında düşməncəsinə münasibət yaratmaq; düşünüşdürmək, aralarını vurmaq, vuruşdurmaq. *Səttarzadə başını tovladı: – Siz məni doğma qızım ilə ləc salmaq istəyənlərin iftirasına uymayın, yoldaş!* Mir Cəlal.

**LƏCLƏŞMƏ** "Ləcləşmək"dən *f.is.*

**LƏCLƏŞMƏK** *f.* Düşmən olmaq, yola getməmək, düşünüşmək, ləc düşmək.

**LƏCLİK** *is.* Tərslik, kəclik, inadkarlıq. *Ləclik etmək. Ləclik göstərmək.* ◻ **Ləcliyinə salmaq** – inad göstərmək, tərslik eləmək. [Qoca:] *Ey pəhləvan, ləcliyinə salma, gəl otur, çörəyini ye.* (Nağıl).

**LƏÇƏK** *is.* 1. Ağdan, çitdən, ipəkdən və s.-dən üçkünc qadın baş örtüyü. *Nəhayət* [Gövhər] *.. ləçəyini açıb qulaqlarının və qaşının üstündən çəkdi.* Ə.Əbülhəsən.

2. *bot.* Çiçək tacında olan yarpaq, gül yarpağı. *Dağgülünün çiçəkləri; Nanələrin ləçəkləri; Parıltılı şehlə dolu.* M.Dilbazi. *Şairin gözündən iki damla yaş; Düşür çiçəklərin ləçəklərinə.* B.Vahabzadə. ◻ **...arvad (övrət) ləçəyi olsun** – "bu işi görməsəm və ya görə bilməsəm kişi deyiləm" mənasında. [Rüstəm bəy:] *..Hərgah onu atası yoluna göndərməsəm, bu papaq mənə övrət ləçəyi olsun!* N.Vəzirov. [İbad:] *Əyər biləm o bura gəlibdir, onun böyük tikəsini qulağına döndərməsəm, bu, papaq olmasın, lap arvad ləçəyi olsun!* C.Cabbarlı.

◊ **(Başına) ləçək örtmək** – öz namusuna, şərəfinə, mənliyinə toxunacaq hərəkət etmək,

qorxaqlıq göstərmək. *Qoç Koroğlu ləçək örtməz başına; Düşmən qabağında gülmək gərəkdir.* "Koroğlu".

**LƏÇƏK-LƏÇƏK** *sif.* Ləçəklərdən ibarət, ləçəklər halında. *Dəyirman üstü çiçək; Yarpağı ləçək-ləçək; Qardaş bir qız sevibdir; Uzunboy, qarabirçək.* (Bayatı). *Ağaclar açsın çiçək; Yarpağı ləçək-ləçək.* M.Ə.Sabir.

**LƏÇƏKLƏNMƏ** "Ləçəklənmək"dən *f.is.*

**LƏÇƏKLƏNMƏK** *f.* Ləçək-ləçək olmaq, ləçək açmaq, ləçək halına gəlmək. *Qızılgül ləçəkləndi. – Bənövşə çiçəkləndi; Yarpağı ləçəkləndi; Yatdığı yalan oldu; Ölümü gerçəkləndi.* (Bayatı). *..Məktəbin həyəti yazın al gülü və təzə-təzə böyüyüb ləçəklənən qoz yarpağı ətri ilə dolu idi.* Ə.Əbülhəsən.

**LƏÇƏKLİ** *sif.* 1. Başına ləçək bağlamış, başında ləçək olan. *Ləçəkli qız. Ləçəkli qadın.*

2. *bot.* Ləçək açmış, ləçəkləri olan. *Ləçəkli gül. Ləçəkli pambıq.*

**LƏÇƏKLİK** *is.* 1. Ləçəyə yarar ağ və ya çit və s. *Ləçəklik parça.*

2. Bir ləçəyə lazım olan miqdarda parça. *İki ləçəklik çit.*

**LƏÇƏKOTU** *is. bot.* Bataqlıq yerlərdə bitən, gön aşılamaq üçün istifadə edilən bir bitki. *Ləçəkotu bataqlıq yerlərdə bitir, kökü, yarpağı və gövdəsi gönü aşılamaq üçün yararlıdır.* M.Qasımov.

**LƏÇƏR** *is.* və *sif. dan.* Abırsız, həyasız, əxlaqsız mənasında söyüş (yalnız qadınlar haqqında). [Vəzir:] *Kəs səsini, ay ləçər, məni dilə basdırma, dəxi səni mən tanıdım.* M.F.Axundzadə. [Xırda xanım:] *..Yoxsa, o qızların oxutmuş ləçərlər əgər bilsələr, oğlanı çəkəcəklər bəndlərinə.* N.Vəzirov.

**LƏFFAZLIQ** *is.* [*ər.*] *klas.* Boş və mənasız danışma; naqqallıq, boşboğazlıq. *Nadirin zehninin və ağlının şərafətini dərk etməyib, fəqət özünün zəhlə getmiş ləffazlığı ilə xanəndəni məşğul edir.* M.F.Axundzadə.

**LƏFZ** *is.* [*ər.*] Ağızdan çıxan mənalı, ya mənasız səs tərkibi; söz, kəlmə. *..Axund bərk-dən-bərk bizə tapşırdı ki, ayama ləfzini dilimizə gətirməyək, ləqəb deyək.* C.Məmmədquluzadə. ◻ **Ləfz etmək** – tələffüz etmək, demək, ifadə etmək, bildirmək. *Ləfz edərsə ifadə mənanı; Sərf edər əhli-mərifət anı.* S.Ə.Şirvani.

**LƏĞƏNDƏ** *is. k.t.* Ağacın cavan budaqlarını yerə basdırmaqla ağac artırma üsullarından biri; daldırma. *Yerdə ləğəndə üsulundan istifadə edərkən budağın qabığını dib tərəfdən halqa şəklində kəsirlər, sonra budağı əyərək torpağı basdırırlar.* İ.Axundzadə.

**LƏĞM** b a x **lağım**. *Bu yazıqlar deyilmidir fabriklərdə çalışan; Ləğmlərdə külüng çalan, zəhmətlərə alışan.* A.Səhhət. [Nüşabə:] *O laçın bürcünə bu dağlardan; Atılan ləğm necə?* A.Şaiq.

**LƏĞV[1]** *is.* [*ər.*] Yox etmə (edilmə), aradan qaldırma (qaldırılma). *Nöqsanların, kəsirlərin ləğvi.* ◻ **Ləğv edilmək (olunmaq)** – 1) aradan qaldırılmaq, yox edilmək; 2) fəaliyyəti (qüvvəsi) dayandırılmaq, tövsiyə edilmək. *İdarə ləğv olunmuşdur. Qərar ləğv edilmişdir.* – [Çar ordusu] *komandanlığının Qarabağ xanlığını ləğv edə biləcəyi ehtimalı* [İbrahim xana] *rahatlıq vermirdi.* Çəmənzəminli. **Ləğv etmək** – aradan qaldırmaq, yox etmək; fəaliyyətini dayandırmaq, tövsiyə etmək. M.Ə.Sabir. *Onlar "silahları ləğv edək!" – deyir; Onlar silahlanır gizlində ancaq.* B.Vahabzadə. **Ləğv olmaq** – aradan qalxmaq, yox olmaq. *Sünniyü şiə təəssübləri ləğv oldumu ya? Nədən ləğv oldu peymanlar; Verildi odlu fərmanlar.* M.Ə.Sabir.

**LƏĞV[2]** *is.* [*ər.*] *köhn.* 1. Boş, bihudə, əbəs söz; cəfəngiyat.

2. Naqqal, boşboğaz, gəvəzə. ◻ **Ləğv olmaq** – boşboğazlıq etmək, hərzə danışmaq, naqqallıq etmək. *Ləğv olma, ədəb gözlə bu məvadə, əkinçi! Lal ol, a balam, başlama fəryadə, əkinçi!* M.Ə.Sabir.

**LƏĞVİYYAT** *is.* [*ər.*] Boşboğazlıq, cəfəngiyat, boş-boş sözlər.

**LƏH** *təql.* Dayanmış atı hərəkət etdirmək, qaçırtmaq məqsədilə çıxarılan səs.

**LƏHCƏ** *is.* [*ər.*] 1. *dilç.* Ümumi dialekt xüsusiyyətlərinə malik olan hər hansı bir dilin yerli şivələr qrupu; dialekt.

2. *köhn.* Dil mənasında. *Məcnunu deyərlər əhli-idrak; Əşarı lətifü ləhcəsi pak.* Füzuli. *Qaş qara, göz piyalə, dişləri dür, püstə dəhan; Şux yanaq, ləl dodaq, ləhcəsi də canlar alan.* Q.Zakir. *Nədən bu torpağın şirin ləhcəsi; – Şairəm, – deyənə biganə qalsın?* S.Vurğun. // Danışma tərzi, tələffüz.

*Ləhcəsi ahəstə, üzü xoş gülən; Nüktəşünas, əhli-kamal, dərd bilən.* Aşıq Qurbani. [Qızların] *şirin ləhcələri, duzlu danışıqları, mütənasib əndamları və alıcı, xumar .. gözləri vardır.* M.S.Ordubadi.

**LƏHCƏŞÜNAS** [*ər*. ləhcə və *fars*. ...şünas] *köhn*. b a x **dialektoloq**.

**LƏHCƏŞÜNASLIQ** *köhn*. b a x **dialektologiya**.

**LƏHLƏMƏ** "Ləhləmək"dən *f.is.*

**LƏHLƏMƏK** *f.* Bərk qaçmaq, yerimək, yoxuş çıxmaq və s. nəticəsində, yaxud hərarətin təsirindən tez-tez və ağır nəfəs almaq, tövşümək (adətən heyvanlar haqqında). *Atlar ləhləyir. Quzu istidən ləhləyir. – Ləhləyirlər, tərləyirlər, əl-üzləri qızarmış; Bir parası çox üşüyür, əl-üzləri bozarmış.* A.Səhhət. [Xəlfə:] [Dursun] *yazıq-yazıq* [çəməndə] *uzanıbdır, tazı kimi ləhləyir.* C.Cabbarlı. *Mal-qara özünü kölgəliyə verib gövşəyir, .. itlər dilini bir qarış çıxararaq ləhləyirdi.* M.İbrahimov.

**ləhləyə-ləhləyə** *zərf* Ləhləyərək, tez-tez, ağır nəfəs ala-ala; tövşüyə-tövşüyə. *Əhməd evdən ildırım kimi həyətə qaçıb sevinə-sevinə və ləhləyə-ləhləyə gəldi anasının yanına.* C.Məmmədquluzadə. *Sanki Müqim bəy Cavanşir də ağzını açır, ləhləyə-ləhləyə güclə nəfəs alırdı.* S.Rəhimov.

**LƏHLƏŞMƏ** "Ləhləşmək"dən *f.is.*

**LƏHLƏŞMƏK** *f.* Ləhləmək (bir neçə heyvan bir yerdə). *Qoyunlar ləhləşir. – Heyvan da ilan mələyəndə ləhləşib dilini bir qarış çıxardır.* İ.Hüseynov.

**LƏHLƏTMƏ** "Ləhlətmək"dən *f.is.*

**LƏHLƏTMƏK** *f.* 1. Ləhləməsinə səbəb olmaq, tövşütmək. *Günün istisi yolçuları ləhlədir. – Günün hərarəti xalqı ləhlədir; Kəndə tərəf bir uşaq yolnan gedir.* A.Səhhət.

2. *məc.* Birini yorulana qədər işlətmək, işlə yükləmək, əldən salmaq.

**LƏHZƏ** *is.* [*ər.*] Ən cüzi bir zaman, bir göz qırpımlıq vaxt, an, dəm. *Cananı görən ləhzədə can düşdü ayağa; Yalvardı gəda iczilə sultanını görcək.* S.Ə.Şirvani. ◻ **Bir ləhzə** – bir saniyə, bir an, bir dəm, göz açıbyumunca. *Sanma ki, bir ləhzə keşikçim yatır; Fikri qalıb məndə nigahbanım.* A.Səhhət. [Kərəm:] *Canım Əsli, bir ləhzə mənimlə otur, səni tapmışam və səndən ayrıla bilmərəm.* Ü.Hacıbəyov. **Bir ləhzədə, bir ləhzə içində** – dərhal, o saat, bir göz qırpımında, göz yumub açınca. [Vaqif:] *Əhli-zülmü necə bərbad eylədi bir ləhzədə; Sən bizim dağlar pələngi qəhrəman Eldara bax!* S.Vurğun. // Ümumiyyətlə zaman, vaxt, müddət. ◻ **Hər ləhzə, hər ləhzədə** – həmişə, hər vaxt, hər zaman, daima. *Bica yerə hər ləhzədə min şurü-şərin var; Çox pis nəzərin var.* M.Ə.Sabir. *Hansı bir kəsbə yapışdım ki, yar olsun tale; Sən çıxıb qarşıma hər ləhzədə oldun mane.* A.Səhhət.

**LƏHZƏLİK** Adətən "bir" sözü ilə – bir anlıq, çox az müddət üçün, bir göz qırpımlıq. [Vaqif:] *Molla Vəli, .. bu qəhvənin qoxusunda duyduğum bu bir ləhzəlik ləzzət dünyanın bütün əzabını unutdurur*. Çəmənzəminli.

**LƏXLƏXƏ** *is. dan*. Pozğunluq, qarışıqlıq, şuluqluq. ◻ **Ləxləxə salmaq** – ara qarışdırmaq, pozğunluq salmaq, şuluqluq salmaq. [Aftil:] *..Müəllimə kəndə ləxləxə salır*. C.Cabbarlı.

**LƏXT-LƏXT** *klas*. b a x **laxta-laxta**. *Ləxtləxt olmuş cigərlər, sanma könlümdən gələn; Namələrdir kim, bəna məcnuni-şeydadən gəlir.* Qövsi.

**LƏİN** *sif.* və *is.* [*ər.*] b a x **məlun**. *Bu isə, bəs o ləinin də işi qüllabıdır; Dini, imanı danıb, yoldan azıbdır, babıdır.* M.Ə.Sabir. [Qoca:] *Ləin! Çəkil, Allahın düşməni!* A.Divanbəyoğlu. [Molla Kərim:] *Ey insan cildinə girmiş şeytani-ləin, söylə, söylə görüm kimsən, nə günahın sahibisən və nə üçün xortdamısan?* B.Talıblı.

**LƏK** *is.* Tərəvəz, gül və s. əkmək üçün bostanda, bağçada və s.-də dördkünc və ya uzunsov şəkildə bellənib ayrılmış yer. *Çəltik ləki. Gül ləki. Göyərti ləki. – ..Kənarda keşniş, kəvər və tərxun ləkləri gözə çarpırdı.* Çəmənzəminli. *..Ləklərə çiçək .. toxumu səpdilər*. Ə.Məmmədxanlı.

**LƏKƏ** *is.* 1. Ləkələyici bir şeyin səth üzərində buraxdığı iz. *Qan ləkəsi. Yağ ləkəsi. Mürəkkəb ləkəsi. Paltarındakı ləkəni silmək. –* [Eldar] *sazın üstündə tünd-qara ləkələri mənə göstərdi*. M.Rzaquluzadə. *Yuyuldu, divarlara; Sıçramış qan ləkəsi*. Ə.Cavad. ◻ **Ləkə düşmək** – b a x **ləkələnmək** 1-ci mənada. *Dəftərinə Gülərin; Düşdü qara bir ləkə.* M.Dilbazi. **Ləkə salmaq** – b a x **ləkələmək** 1-ci mənada.

*Şahsənəməm, sən də inan sözümə; Gözüm yaşı ləkə saldı üzümə.* "Aşıq Qərib". *Onun ağzından axan qan döşəməyə parlaq ləkələr saldı.* Ə.Vəliyev. // Bədənin müxtəlif yerlərində hər hansı bir səbəbə görə əmələ gələn rəng dəyişikliyi. *Üzünə ləkə düşmək. Əlinin üstündə ağ ləkələr var. Gözündə ləkə var. – Həkim Həsənin ciyərində kiçik bir ləkə olduğunu söylədi.* Çəmənzəminli. *Gülsəhər ortaboylu, .. ağ-qırmızı sifətində kiçik ləkələr görünən bir arvad idi.* Ə.Vəliyev.

2. *məc.* Adamı ləkələyən, rüsvay edən, alçaldan şey; rüsvayçılıq, biabırçılıq, şərəfsizlik. *İntihara gəldikdə, o, insanın üzərinə atılan ləkələri daha da tutqunlaşdırır.* M.S.Ordubadi. [Kərbəlayı Əzim:] *Bu vaxtadək üstümüzdə ləkə olmayıb, bir elə iş baş verməyib ki, bizi ləkələsin.* T.Ş.Simurq. ☐ **(Üstünə) ləkə atmaq (vurmaq, yaxmaq)** – birinin namusuna, şərəfinə toxunacaq söz demək, böhtan atmaq, biabır etmək, olmayan şeyi ona isnad etmək. [Səməd:] *Yoldaş sədr, bu kişi yalan danışır, üstümə ləkə atır.* B.Talıblı.

◊ **Ağ ləkə** – coğrafiya xəritəsində: öyrənilməmiş yer.

**LƏKƏAPARAN** *sif.* və *is.* Ləkəni təmizləmək üçün xüsusi üsulla hazırlanmış kimyəvi maddə.

**LƏKƏCİK** *is.* Kiçik ləkə, balaca ləkə. *Üzündə ləkəciklər var.*

**LƏKƏDAR** *sif.* və *is. köhn.* bax **ləkəli** 3-cü mənada. ☐ **Ləkədar edilmiş** – bax **ləkələnmiş** 2-ci mənada. [Əhməd:] *Binamus bacı, namussuz qardaş, heç tələsməyin, nə qədər mən həyatda varam, ləkədar edilmiş namusumun intiqamını sizdən alacağam.* C.Cabbarlı. **Ləkədar etmək** – bax **ləkələmək** 2-ci mənada.

**LƏKƏ-LƏKƏ** *sif.* və *zərf* Çoxlu ləkələri olan, ləkə düşmüş, ləkəli. [Lalənin] *tuflisi və tumanı gil məhlulundan ləkə-ləkə olmuşdu.* M.Hüseyn.

**LƏKƏLƏMƏ** "Ləkələmək"dən *f.is.*

**LƏKƏLƏMƏK** *f.* 1. Paltara, yaxud bir şeyin üstünə ləkə salmaq; batırmaq, bulamaq. *Paltarını ləkələmək. Kitabı ləkələmək. Çəkmələrini ləkələmək.*

2. *məc.* Birisinin adına, şərəfinə toxunulacaq söz demək; olmayan şeyi ona isnad etmək, bədnam etmək, rüsvay etmək, biabır etmək, hörmətdən salmaq, qara yaxmaq. [Molla Xəlil] *müəllimi xalq nəzərində ləkələmək üçün İslamı qurşamışdı ki, şikayət etsin.* S.Hüseyn. [Barat:] *Yoldaş Şərif, nə haqq ilə sən müəllimə Almaz xanımı biabır edirsən, ləkələyirsən?* C.Cabbarlı.

**LƏKƏLƏNDİRMƏ** "Ləkələndirmək"dən *f.is.*

**LƏKƏLƏNDİRMƏK** bax **ləkələmək**. *Zeynal öz yaramazlıqlarını doğrultmaq üçün mühitlərini ləkələndirməyə çalışan bir qrup adamlara mənsub idi.* S.Hüseyn.

**LƏKƏLƏNMƏ** "Ləkələnmək"dən *f.is.* *Biz heç vaxt öz qəhrəman əcdadımızın şanlı adının və xatirəsinin ləkələnməsinə razı olmayacağıq.* Ə.Əbülhəsən.

**LƏKƏLƏNMƏK** *f.* 1. Ləkələndirici bir şeydən üzərinə ləkə düşmək, ləkə tutmaq, ləkə-ləkə olmaq; batmaq, ləkələrlə örtülmək. *Örpəyi ləkələnmək. Paltosu ləkələnmək. – Eyvanın məhəccərini toz basmış, əlüzyuyanın güzgüsü ləkələnmişdi.* Ə.Vəliyev.

2. *məc.* Bədnam olmaq, rüsvay olmaq, biabır olmaq. [İncə:] *Hər bir halda qızın adı ləkələnsə, ölüm ondan yaxşıdır.* C.Cabbarlı. *Midhəd namusunun ləkələndiyini, şərəfinin çeynəndiyini nəzərinə gətirdi.* Ə.Vəliyev.

**LƏKƏLƏNMİŞ** *f.sif.* 1. Üstünə ləkələr düşmüş, ləkə tutmuş, ləkə-ləkə olmuş; ləkəli. *Ləkələnmiş paltar.*

2. *məc.* Biabır olmuş, rüsvay olmuş (edilmiş), ləkə (2-ci mənada) vurulmuş.

**LƏKƏLƏTMƏK** bax **ləkələndirmək**.

**LƏKƏLİ** *sif.* 1. Ləkəsi olan, üzərinə ləkə və ya ləkələr düşmüş, ləkə basmış; çirklənmiş, batmış, bulanmış. *Ləkəli parça. Ləkəli ayaqqabı. Ləkəli örpək. Ləkəli paltar.*

2. Gözün ağında qara və ya qırmızı xal (ləkə) əmələ gəlmiş. *Ləkəli göz.* – [Naşadın] *üzündə çopurluq əlaməti olduğu kimi, gözünün bir tayı da ləkəli idi.* S.Hüseyn.

3. *məc.* Üstündə ləkə (2-ci mənada) olan. *Ləkəli ad. Ləkəli adam.* – [Almaz:] *Ləkəli adla yaşamaqdansa, ölüm yaxşıdır.* C.Cabbarlı.

**LƏKƏLİLİK** *is.* Ləkəli şeyin və ya adamın halı.

**LƏKƏR** *is. dan.* Görkəm, surət, sir-sifət. *Bir ləkəri yoxdur.*

**LƏKƏRSİZ** *sif.* Kifir, çirkin, bədləkər.

**LƏKƏSİZ** *sif.* 1. Təmiz, aydın, açıq, saf. *Ləkəsiz səma. Ləkəsiz üfüq. – Göylərin aynası, ləkəsiz* (z.) *durur; Xilqətin ən dərin mənası budur*. S.Vurğun. *Mavi üfüqlər dumduru, ləkəsiz və nəhayətsiz görünürdü*. M.İbrahimov. *Səhər çağı hava sərin; Göylər ləkəsiz*. R.Rza.

2. *məc.* Şərəfli, namuslu, adı təmiz, alnıaçıq. *Ləkəsiz qız. – Öz ləkəsiz vicdanınla; Ana yurdu möhkəm qoru!* Ə.Cəmil.

**LƏKƏSİZLİK** *is.* Ləkəsiz şeyin və ya adamın halı; ləkəsiz olma.

**LƏKLƏMƏ** "Ləkləmək"dən *f.is.*

**LƏKLƏMƏK** *f.* Lək düzəltmək, lək qayırmaq. *Həyəti ləkləmək. – Bostanı ləklədilər; Tağını təklədilər; Düşdüm nadan əlinə; Nazımı çəkmədilər.* (Bayatı).

**LƏKLƏTMƏ** "Ləklətmək"dən *f.is.*

**LƏKLƏTMƏK** *f.* Lək düzəltdirmək, lək qayırtdırmaq. *Bostanı ləklətmək. Göyərti üçün yer ləklətmək.*

**LƏKTƏ** *sif. dan. köhn*. Həyasız, abırsız (ancaq qadınlar haqqında). [Şərəfnisə xanım Gülçöhrəyə:] *İtil cəhənnəmə, ləktə, əl çəkməz, qoymaz işimi tutum.* M.F.Axundzadə.

**LƏQƏB** *is.* [*ər.*] Müəyyən bir səciyyəvi xasiyyətinə və ya başqalarından ayrılan əlamətinə görə adama verilən qeyri-rəsmi ad; ayama. [Mədəd:] *Sənə Koroğlu ləqəbini verməkdə, Tapdıq, səhv etməmişik.* Ə.Əbülhəsən. *Bizim şəhər və kəndlərdə keçmişdə hamının ləqəbi olardı.* M.Rzaquluzadə.

**LƏQƏBLİ** *sif.* Ləqəbi olan, ləqəb daşıyan; ayamalı. *Qonşuda yaşayan Danqılıbəy ləqəbli birisi, nədənsə, yediklərinin artığını həmişə buraya atardı.* Çəmənzəminli.

**LƏL** *is.* [*ər.*] 1. Qırmızı rəngli qiymətli daş. *Qasid badəni içdi. Ləli öpüb cibinə qoydu*. "Koroğlu". *Bunun evində ənfiyədan da vardır, onun üstündə ləl və cavahiratdan düzəlmiş çılpaq bir qadın şəkli vardır*. M.S.Ordubadi.

2. *məc. şair*. Qırmızı şeylərə, xüsusən yanağa, dodağa və s.-yə işarə. *Dişlədimsə ləlin, ey qanım tökən, qəhr eyləmə; Tut ki, qan etdim, ədalət eylə, qanı qanə tut*. Füzuli. *Şux yanaq, ləl dodaq, ləhcəsi də canlar alan*. Q.Zakir. // *məc*. Saf, şəffaf şey haqqında. [Yusif Şahmara:] *Barmaqlarımı kəsərəm, əgər əkdiyim tənəklər üstü dolusu ləl gətirməsə*. B.Bayramov.

**LƏL-CAVAHİRAT** *top*. [*ər.*] Qiymətli daş-qaş, cavahirat. *Təmiz ad, təmiz ürək bu dünyada ləl-cavahiratdan da qiymətlidir!* S.Rəhimov.

**LƏLƏ** *is.* 1. Keçmişdə kübar və varlı ailələrdə oğlan uşağının tərbiyəsilə məşğul olan adam. [Qətibə xanım:] *Səba xanım, özümü çox fəna hiss edirəm, Qutluğu lələsinə tapşırın*. M.S.Ordubadi. *Hacı Səmsam .. başqa mülkədarlar kimi oğlu üçün lələ saxlamırdı.* P.Makulu.

2. Böyüyə, yaşlı kişilərə müraciət zamanı işlədilir. [Fərhad:] *Eybi yoxdur, gəlin içəri, xoş gördük, lələlərim*. Ə.Haqverdiyev. *Lələ, səndən bir şey soruşacağam, gizləmə, doğrusunu söylə.* S.S.Axundov. [Qədir:] *Ay lələ, yavaş sürün!..* Mir Cəlal. // *dan*. Hörmət üçün özündən böyük adamın adına əlavə olunur. [Rəhim:] *Rəhmətlik bəy mənə Rəhim lələ deyərdi*. Ə.Haqverdiyev. [Məstan:] *Qoy Tapdıq lələ .. qağamdan danışsın*. Ə.Əbülhəsən.

**LƏLƏDAĞ: lələdağ etmək** *məh.* – hirsləndirmək, acıqlandırmaq, dəhşətə salmaq. *Qaçaq Nəbi boz ata minib aynalı ilə naçalnikləri, pristavları nə təhər lələdağ edirdisə, Midhəd də quzğun sürüsünü elə pərən-pərən saldı.* "Qaçaq Nəbi".

**LƏLƏGİLƏ** *is.* Uşağı ovutmaq üçün ona verilən hər hansı bir şey (şirni, meyvə və s.). *Uşağı lələgilə ilə dilə tutmaq.*

**LƏLƏK** *is.* 1. Quşların qanadlarının və quyruqlarının uclarındakı uzun saplaqlı tük. [Qız] *eyvanın küncündə ları xoruzun qanadından düşmüş uzun lələyi görüb sevincək götürdü.* M.İbrahimov. *Hər il ovçular yüz milyon manatlarla qiyməti olan xəz, dəri, piy, ət, quş tükü, lələk və s. məhsul əldə edirlər.* M.Rzaquluzadə. // Bəzək üçün baş geyiminə taxılan belə tük. *Şlyapaya lələk taxmaq*.

2. *məh*. Qarğının üst qabığı.

**LƏLƏKLƏNMƏ** "Lələklənmək"dən *f.is.*

**LƏLƏKLƏNMƏK** *f.* 1. Lələyi görünməyə başlamaq, lələyi çıxmaq. *Cücə lələkləndi*.

2. Lələyi tökülmək, lələyi düşmək. *Xəstə toyuq lələklədi*.

**LƏLƏKLİ** *sif.* 1. Uzun lələkləri olan, lələklə örtülmüş (quşlar haqqında). [Zərrintac xanım:] *Alagöz, sən mənə qulluq edərsən, mən də səni lələkli tovuz kimi bəzərəm.* S.Rəhimov.

2. Lələk taxılmış, lələk keçirilmiş, lələklə bəzədilmiş. *Lələkli şlyapa.* – "*Yaşasın!*" *bağırtısı; Qopunca hər bir yandan; Hərəkət əmri verdi; Lələkli baş komandan.* Ə.Cavad.

3. *İs. mənasında*. **Lələklilər** – quşlar.

◊ **Lələkli buludlar** *coğr.* – çox hündürdə olan ağ rəngli, kölgəsiz buludlar.

**LƏLƏKSİZ** *sif.* Hələ lələyi çıxmamış və ya lələyi tökülmüş. *Lələksiz quş*.

**LƏLƏKTÖKMƏ** *is.* Quşlarda: köhnə lələkləri töküb, yeni lələklər çıxarma prosesi. *Sürünənlər qabıq qoyduqları kimi, quşlar da lələk tökürlər. Lələktökmə zamanı bədəndəki lələklər tökülür və onların yerində yeni lələklər çıxır.* "Zoologiya".

**LƏLƏKVARİ** *sif.* Lələyəoxşar, lələk kimi. *Lələkvari yarpaq*. – [Göyrüş ağacının] *yarpaqları lələkvari şəkildə düzülmüşdür.* H.Qədirov.

**LƏLƏLİK** *is. köhn*. Lələnin gördüyü iş; tərbiyəçilik. [Cəbi:] *Allah mənə o qədər ömür versin ki, Qəmər xanımın uşaqlarına lələlik edim.* S.S.Axundov.

◊ **Lələlik etmək** *məc.* – yaltaqlanmaq.

**LƏLƏŞ** *is. zar*. Bir adam özünü öydüyü, lovğalandığı zaman özünə işarə olaraq işlətdiyi söz (yalnız şəxs sonluqları ilə işlənir). [Süleyman Əsgərə:] *Gördüyün qızlardan birisini seç, sonra lələşini göndər, gedim elçilik eləyim, vəssalam.* Ü.Hacıbəyov. [Qurban:] *Nə deyim, Hacı Cəlalın pulu məndə olaydı, görərdin lələşin nə lələşdir.* Ə.Haqverdiyev. *Qorxma, lələşin ölməyib ki*. Ə.Əbülhəsən.

**LƏLİ** *dan*. b a x **nənni**.

**LƏLİMƏ** "Ləlimək"dən *f.is.*

**LƏLİMƏK** *f. dan*. 1. Yalvarmaq, yalvarıbyaxarmaq.

2. Bir şeyin həsrətində olmaq, arzusunda olmaq. *Aşdan ötrü ləlimək. Uşaq oyuncaq üçün ləliyir.*

**LƏLO: ləlo getmək** *dan*. – yeməli bir şeyin həsrətində olmaq, həddən artıq istəmək. *Kababdan ötrü ləlo gedir.*

**LƏLÖYÜN** *sif. dan*. Acgöz, tamarzı, görməmiş. // İs. mənasında. *Acdan ləlöyün törər*. (Ata. sözü). // Ehtiraslı, həris.

◊ **Ləlöyün getmək** – bir şeyin arzusunda olmaq, həsrətini çəkmək; bir şey üçün əldən getmək. [Veys:] *Sən ondan ötrü, deyəsən, lap ləlöyün gedirsən ki!* Ə.Əbülhəsən.

**LƏLÖYÜNLÜK** *is.* Acgözlük, görməmişlik, hərislik, tamarzılıq.

**LƏM¹** *is.* [*ər.*] *köhn.* Parlama, parıldama.

**LƏM²** *is. məh.* 1. Talvar.

2. Mağara.

**LƏMƏ** *is.* Tavandan bir az aşağı divar uzunu kərpicdən, taxtadan, palçıqdan qabqacaq düzmək üçün düzəldilmiş yer; rəf. *Astanada tüstülənir böyrü batıq samovar; Ləmədəsə rəngi uçmuş beş-on nimçə, kasa var.* S.Rüstəm.

**LƏMƏLİ** *sif.* Ləməsi olan; rəfli. *Ləməli otaq.*

**LƏMPƏ** *is. məh*. Tavan, səqf. *Düz stolun üstündən, ləmpədən asılmış onluq lampa şölələnirdi*. B.Bayramov.

**LƏMPƏLİ** *sif. məh*. Ləmpə vurulmuş; tavanlı, səqfli. *Ləmpəli otaq.*

**LƏMS** *sif.* [*ər.*] Əzgin, süst, halsız, ölgün, hissiz. □ **Ləms etmək (eləmək)** – hiss etmək, duymaq. *Qulağımı ləms etdi o zamanda; Duydum, uçur mələklər asimanda.* A.Səhhət. **Ləms olmaq** – halsız olmaq, keyləşmək, süstləşmək, əzginləşmək.

**LƏMSLƏŞMƏ** "Ləmsləşmək"dən *f.is.*

**LƏMSLƏŞMƏK** *f.* Süstləşmək, keyləşmək, halsızlaşmaq, hissizləşmək. [Dərviş:] *Özümü itirdim, nə etməliyəm bilmədim, .. huşum və bədənim ləmsləşdi, pozğunlaşdım.* A.Divanbəyoğlu.

**LƏMYESİR** *dan*. b a x **əsir-yesir**. [Yetər:] *Bu bir belə ləmyesirin duası qoymaz ki, Xalıqverdi qardaşın başından bir tük əskik olsun.* Ə.Vəliyev.

**LƏN** *klas*. b a x **lənət**. [Şeyx Hadi:] *Qaliba sizcə öylə bir ustad; Olunur imdi lənü tənlə yad?!* H.Cavid. □ **Lən etmək (eyləmək)** – lənətləmək, lənət oxumaq. *Lən eyləyərək qasibə məxluqu soyursan; Fani deyərək aləmi təmir eləyirsən.* M.Ə.Sabir.

**LƏNBƏR: lənbər vurmaq** *dan*. – ləngərlənmək, tərpənmək, yanlarından tökülmək, daşmaq (dolu qabdakı maye haqqında). *Vedrədəki su lənbər vurur*.

**LƏNDƏHOR** *sif. dan*. Qaba, kobud, nataraz, yekəpər, zorba. *Ləndəhor adam*. // Qaydasız, səliqəsiz, biçimsiz. *Ləndəhor paltar*.

**LƏNƏT** [*ər.*] 1. Dini etiqada görə Allahın mərhəmətindən məhrum olma, nifrin (adətən köməkçi feillərlə işlənir). ◻ **Lənət damğası basmaq** – lənətləndirmək. **Lənət etmək (eləmək, oxumaq, yağdırmaq)** – nifrin etmək, qarğımaq. *Ürəyində ağrı, gözündə həsrət; O, lənət yağdırdı çərxi-dövrana.* B.Vahabzadə.

◊ **Lənət sənə, kor şeytan!, lənət şeytana!** – arzuedilməz bir hərəkətdən çəkinmək istərkən deyilən nida ifadəsi. [Süleyman:] *Əsgər mənə etibar edib elçiliyə göndəribdir, özü də qıza bənddir. Necə ola bilər ki, onu məyus eləyim, lənət şeytana!* Ü.Hacıbəyov. *Belə-belə fikir Məşədi Əsgərin başına gəldikcə .. "lənət şeytana!" deyib başından çıxardırdı.* S.M.Qənizadə. *Xalıqverdi kişi özünü toxtatdı, ürəyində "lənət sənə, kor şeytan!" – dedi.* Ə.Vəliyev.

**LƏNƏTLƏMƏ** "Lənətləməkdən" *f.is.*

**LƏNƏTLƏMƏK** *f.* Nifrin etmək, qarğımaq, lənət oxumaq. *İskəndər "Ölülər aləmi"nin saxtakarlığını, yalanını, puç və mənasızlığını faş edib lənətləyir.* M.İbrahimov. *Lənətlədi, od yağdırdı, yurdum hər yandan; Ölüm! – dedi, – qart düşmənə, – yurdumun səsi.* N.Rəfibəyli.

**LƏNƏTLƏNMƏ** "Lənətlənmək"dən *f.is.*

**LƏNƏTLƏNMƏK** *məch.* Qarğınmaq, nifrin edilmək.

**LƏNƏTÜLLAH** [*ər.*] *nida.* "Allahın lənəti olsun!" mənasında qarğış kimi işlədilən ifadə. *Hacı arabadan düşdü, "tfu, lənətüllah!" deyib, təsbeh çevirə-çevirə kəndə sarı getdi.* Mir Cəlal.

**LƏNG** [*fars.*] *sif.* 1. Ağır, asta, yavaş; ağırtərpənən. *Çox ləng adamdır!* // Zərf mənasında. *Ləng getmək. Ləng işləmək. Ləng danışmaq. – Onun gərdişində bir azca ləng var; Aləmə əyandı, görünür aşkar*. Aşıq Ələsgər. *Qara Kərəmoğlunun ağzından sözlər nisbətən ləng və soyuq çıxırdı.* M.İbrahimov. [Yusif:] *Siz çox ləng işləyirsiniz.* S.Rəhman. ◻ **Ləng olmaq** – qəsdən yubanmaq, bənd olmaq, dayanıb gözləmək, ilişmək. *Bir bəhanə ilə beş-on dəqiqə* [həyətdə] *ləng olub, oğru adam kimi yavaşca çıxdıq darvazaya tərəf.* C.Məmmədquluzadə. [Sona:] *Bağışlayın, yolda bir qədər ləng oldum*. H.Nəzərli. **Ləngə düşmək** – gecikmək, yubanmaq, dolaşığa düşmək. *Bir fəqirin işi düşüb ləngə; Gəlmiş idi zəmanədən təngə.* S.Ə.Şirvani. *Bağlıdır yol, görürsən, qafilə düşmüş ləngə.* M.Möcüz. [Bayram kişi:] *Ancaq el gücü yaddan çıxıbdır, yəni yaddan çıxmayıb ha, bir azca ləngə düşübdür.* M.Rzaquluzadə. **Ləngə salmaq** – yubatmaq, gecikdirmək. [Bəkir:] *Qoşun ağır gedir, bizi ləngə salır*. Ü.Hacıbəyov. [Hacı Qurban:] ..*Qoyunun pulunu ləngə salıblar. Ona görə yazıq uşaq qayıdıb gələ bilməyir.* N.Vəzirov.

2. Axsaq, topal. *Ləng adam*.

**LƏNGƏR** *is.* [*fars.*] 1. Bax **lövbər**. *Gəmilərin ləngərini salıb dedilər: – Bu nəzirədə bir müddət seyr edək.* (Nağıl). *Küçələr izdihamla çalxanır; Yükü ağır bir gəminin ləngəri kimi*. R.Rza. ◻ **Ləngər vurmaq (vermək)** – durmadan gah bir tərəfə, gah o biri tərəfə əyilmək; yatıb-qalxmaq, yellənmək, yırğalanmaq. *Gəmi ağır-ağır ləngər vurub, körpüdən aralanmağa başladı.* M.Hüseyn. [Tank] *ləngər vuraraq .. yaxınlaşırdı*. Ə.Məmmədxanlı.

2. Müvazinəti saxlamaq üçün əldə tutulan uzun ağac (adətən kəndirbazlar əllərində tuturlar). *Bir gənc əlinə uzun, şüyül bir ağac – müvazinət ağacı* (*ləngər*) *alaraq, kəndirin üstündə rəqs edərdi.* H.Sarabski. // Tərəzidə və başqa cihazlarda tarazlıq, müvazinət göstərən mil. [Məşədi Möhsün] *daşlar çatışmadıqda, kasanın ləngəri yerdən qalxanadək əlinə gələni tərəziyə atır.* Mir Cəlal. // Məc. mənada. *Çox bilib az danışmaq igidin ləngəridi.* (Ata. sözü).

3. **Ləngərlə** şəklində *zərf* – ağır-ağır, yavaş-yavaş. *Ləngərlə getmək. – Koxa atın yalmanından tutub ləngərlə qalxdı.* S.Rəhimov. *Ağır, yaylı qapının bir tayı ləngərlə aralanmağa başladı*. Mir Cəlal.

**LƏNGƏRİ** *is. köhn*. Siniyəoxşar dayaz mis qab. *Düyünü ləngəriyə boşaltmaq*.

**LƏNGƏRLƏMƏ** "Ləngərləmək"dən *f.is.*

**LƏNGƏRLƏMƏK** *f.* Ləngər vurmaq, hər iki tərəfə yatıb-qalxmaq; yırğalamaq, əyilmək, yellənmək. *Araba yol uzunu ləngərləyir*. – [Maşın] *asfalt üstündə gedirmiş kimi çox rahat, ləngərləmədən, yırğalanmadan yeridi.* B.Bayramov.

**LƏNGƏRLƏNMƏ** "Ləngərlənmək"dən *f.is.*

**LƏNGƏRLƏNMƏK** *f.* Bir tərəfdən o biri tərəfə əyilmək, səndələmək, yırğalanmaq; ləngərləmək, ləngər vurmaq. // Tərpənmək, yellənmək. *Təmiz, ağ kasada yavaşca ləngərlənən sərin və duru su Yunisə həyat kimi şirin gəldi.* Mir Cəlal.

**ləngərlənə-ləngərlənə** *zərf* Ləngər vuraraq, yıxıla-dura, yıxıla-yıxıla, yırğalana-yırğalana, yan basa-basa. *Şahnigar .. Salatını ehmalca kənar edib, qabağa düşdü. Ləngərlənə-ləngərlənə qapıya yaxınlaşdı.* İ.Şıxlı.

**LƏNGƏRLİ** *dan.* bax **ləngəryerişli**. *Gövhər xanım özünəməxsus ağır və ləngərli bir yerişlə yaxınlaşıb pərdələrdən birinin ipini çəkdi.* İ.Hüseynov.

**LƏNGƏRYERİŞ** *is. dan.* Ləngərlənə-ləngərlənə, yan basa-basa yerimə tərzi. *Ləngəryerişi kimdən öyrənibsən?*

**LƏNGƏRYERİŞLİ** *sif.* dan. Ləngərlənə-ləngərlənə, yanını basa-basa yeriyən. *Ləngəryerişli adam.*

**LƏNGİDİCİ** *sif.* Ləngidən, yubadan, gecikdirən.

**LƏNGİDİLMƏ** "Ləngidilmək"dən *f.is.*

**LƏNGİDİLMƏK** *məch.* Yubandırılmaq, gecikdirilmək, vaxtı keçirilmək, vaxtında görülməmək (edilməmək). *..Milli musiqinin inkişafı ləngidilir, biz müsəlmanların musiqi təhsili almaq arzusunun, milad tarixindən bəri ancaq XX əsrdə oyanan bu təbii arzunun qarşısına sədd çəkilir.* Ü.Hacıbəyov.

**LƏNGİMƏ** 1. "Ləngimək"dən *f.is.*

2. *is.* Yubanma, gecikmə. *Bu ləngimələr Nəriman üçün dözülməz idi*. Mir Cəlal.

**LƏNGİMƏDƏN** *zərf* Yubanmadan, gecikmədən.

**LƏNGİMƏK** *f.* 1. Bir yerdə lazım olduğundan, yaxud bir səbəb üzündən artıq qalmaq, ilişib qalmaq. *İki günə getdi, bir həftə ləngidi.* – [Çimnaz:] *Oğul, Bakıda ləngimə ha!* Ə.Əbülhəsən. *Sona ilə kəsdikləri şərtə görə* [Bəhram] *rayonda bir aydan artıq ləngiməməli idi*. Ə.Vəliyev.

2. Vaxtında gəlməmək, gecikmək, yubanmaq. [Səlimə:] *Heç indiyədək belə ləngidiyi yox idi*. Ə.Haqverdiyev. [Şirin:] *Rüstəm bəy həmişə müəyyən vaxta neçə dəqiqə qalmış hazır olar, bəs görəsən, bu gün niyə ləngidi?* Çəmənzəminli. [Hətəmov katibə:] *Bazar ertəsi, bəlkə bir az ləngidim*. B.Bayramov. // Dayanıb durmaq, dayanıb gözləmək, ayaq saxlamaq. *Qapı ağzında ləngimək*. – [Əhməd] *lampanı yandırmadan qaranlıq otaqda xeyli ləngidi.* S.Rəhimov.

3. *məc.* Geridə qalmaq, çatmamaq, dala qalmaq. *Qaçay sevinirdi ki, mebel hardasa ləngiyir. Kimsə onu yola salmağı unudub*. İ.Məlikzadə.

**LƏNGİTMƏ** "Ləngitmək"dən *f.is.*

**LƏNGİTMƏK** *f.* 1. Gecikdirmək, yubatmaq, ləngiməsinə səbəb olmaq. *Mən bir il də Zahidi ləngitdim*. Mir Cəlal. *Meşənin qatı kölgəsi elə bil səhərin açılmasını bir az da ləngitmək, ağacların mürgüləməsinə mane olan səhər mehinin qarşısını almaq, yarpaqların xışıldayıb quşları oyatmasına imkan verməк istəmirdi.* İ.Şıxlı.

2. *məc.* Bir səbəbə görə bir şeyi vaxtında görüb qurtarmamaq, yaxud qəsdən vaxtını uzatmaq, təxirə salmaq. *İşi ləngitmək. Sənədləri ləngitmək. Məktubu ləngitmək.* – [Qoçəlinin] *döyüş xasiyyətnaməsi olmadığından ərizəsini ləngitmək istəyirdilər.* Ə.Vəliyev.

**LƏNGLİK** *is.* Hərəkətdə ağırlıq; ağır tərpənmə, gecikmə, yubanma. *Bir zaman vardı; Verst ağaclarını saya-saya; Üç günə gedərdik Moskvaya; Darıxardıq; Bu sürətin ləngliyinə..* B.Vahabzadə.

**LƏNTƏRAN** *sif.* və *zərf* [*ər.*] *köhn. dan.* Hərzə, hər nə gəldi, ədəbdən kənar, nalayiq. *Ləntəran demək. Ləntəran danışmaq. – Kim yaxşı söylədisə, ona min yaman dedin; Qeyzə gəlib bərəldi gözün, ləntəran dedin.* M.Ə.Sabir.

**LƏPƏ**[1] *is.* 1. Dalğa, kiçik dalğa. *Qara dənizin xəfif ləpələri sahili öpür*(*dü*).. H.Nəzərli.

2. *məc.* İzdiham, insan axını, kütlə mənasında. *Ləpələr bu pilləkənləri saxsı qab kimi vurub qırır*. Mir Cəlal.

3. *məch.* Qüvvətlə təzahür edən şey haqqında. [Dərviş:] *Mən də məğlub oldum, vətən məhəbbətinin aşıb-coşan ləpəsi məni arxasına aldı..* A.Divanbəyoğlu.

**LƏPƏ**[2] *is.* Qoz, fındıq, badam kimi qabıqlı meyvələrin, həmçinin paxlalı bitkilərin içi. *Badam ləpəsi. Qoz ləpəsi. Paxla ləpəsi.* – [Usta Zeynal:] *Afərin şairə! – deyib, qozun ləpəsindən birini ağzına qoyardı*. Ə.Haqverdiyev.

[Kərəmov:] *Sözümü findıq kimi sındırıb içindən ləpə çıxartmayın.* S.Rəhman.

**LƏPƏ³** *is. bot*. Bitkilərdə: rüşeym yarpaqlar.

**LƏPƏALTI** *is. bot*. Bitkinin köklə gövdə üzərindəki rüşeym yarpaqları (ləpələrin) arasında qalan hissəsi. *Çiyidin kökcüyü onun qabığını yırtıb çıxdıqdan sonra, ləpəaltı torpağın üzünə çıxmağa başlayır.* "Pambıqçılıq".

**LƏPƏCİK¹** *is*. Balaca ləpə, dalğacıq. *Hovuzda ləpəcik vardır. – Dənizdə xəfif ləpəciklər oynayırdı*. M.İbrahimov. *Bir gün qafiləsilə; Xan çıxmışdı sahilə; Ləpəciklər quş kimi; Qalxıb uçurmuş kimi.* M.Müşfiq.

**LƏPƏCİK²** *is*. Kiçik ləpə, balaca ləpə, ləpə qırıntısı (b a x **ləpə²**).

**LƏPƏDÖYƏN** *is*. Daim ləpələr çarpan sahil xətti. *Özün də otur ləpədöyəndə, gözlə haçan xəzri gələcək.* C.Cabbarlı. *Bu təpə xeyli mail bir enişlə düz suyun kənarına qədər uzanır, ləpədöyən deyilən əsil sahillə birləşirdi.* M.Rzaquluzadə. *Sükançı göstərin indi siz mənə; Gəlsin, dalğaları o, yara bilsin; Verib sinəsini ləpədöyənə; Gəmini irəli apara bilsin*. B.Vahabzadə.

**LƏPƏLƏMƏ** "Ləpələmək"dən *f.is.*

**LƏPƏLƏMƏK** *f.* Ləpəsini çıxartmaq, qabıqdan içini çıxartmaq, qabığını soymaq. *Qozu ləpələmək. Lobyanı ləpələmək. Noxudu ləpələmək.*

**LƏPƏLƏNDİRMƏ** "Ləpələndirmək"dən *f.is.*

**LƏPƏLƏNDİRMƏK** *f.* Dalğalandırmaq. *Suyu ləpələndirmək. – Biri atar, suyu səpələndirər; Biri qaçar, çayı ləpələndirər*. A.Səhhət.

**LƏPƏLƏNMƏ** "Ləpələnmək"dən *f.is.*

**LƏPƏLƏNMƏK** *f.* 1. Dalğalanmaq. *Günün axır şəfəqləri ahəstəcəsinə ləpələnən suya düşüb onda xüsusi gözəllik vücuda gətirirdi.* T.Ş.Simurq.

2. *məc*. Dəniz dalğalarını xatırladacaq şəkildə yellənmək, tərpənmək; dalğalanmaq. *Kəndin kənarındakı əkinlərin başaqları sakit bir dəniz kimi ləpələnirdi*. S.Hüseyn. *Alqış səsi ləpələnən meşələrə yayıldı, çayların, çeşmələrin şırıltısına qarışdı*. S.Rəhimov.

**ləpə-ləpə** b a x **lapar-lapar** 2-ci mənada. *Göydən enir yerə ləpə-ləpə qar; Bacı, qardaş, ana üzümə baxar*. "Aşıq Qərib".

**LƏPƏLƏTMƏ¹** "Ləpələtmək¹"dən *f.is.*

**LƏPƏLƏTMƏ²** "Ləpələtmək²"dən *f.is.*

**LƏPƏLƏTMƏK¹** b a x **ləpələndirmək**.

**LƏPƏLƏTMƏK²** *f.* Qabığını çıxartdırmaq, təmizlətmək, ləpəsini çıxartdırmaq. *Qozu ləpələtmək. Noxudu ləpələtmək.*

**LƏPƏLİ¹** *sif.* Ləpəsi olan, dalğalı. *Ləpəli dəniz. Ləpəli çay. — Atlar ləpəli, boz-bulanıq suyun köpüklü sinəsini görən kimi dayandı.* İ.Şıxlı.

**LƏPƏLİ²** *sif.* Ləpəsi olan (b a x **ləpə²**).

**LƏPƏSİZ¹** *sif.* Ləpəsi olmayan; sakit, dalğasız. *Ləpəsiz göl. – Dalğa dənizdə yaxşıdır; Dəniz ləpəsiz olmaz.* R.Rza.

**LƏPƏSİZ²** *sif.* Ləpəsi olmayan (b a x **ləpə²**). *Ləpəsiz qoz*.

**LƏPİK¹** *is*. Yastı, dəyirmi balaca daş.

**LƏPİK²** *is. dan*. Evdə geyilən yüngül ayaqqabı; şap-şap.

**LƏPİKDAŞ** *is*. Ləpiklə oynanılan bir oyun (b a x **ləpik¹**).

**LƏPİR¹** *is*. Torpaq, qar və s. üzərində insan və ya heyvan ayağının nişanı, izi. *At ləpiri. Dovşan ləpiri. Quş ləpiri. – Yerə düşmüş şəbnəm hələ qurumamışdı. Yer üzündə beş-altı ayaq ləpiri məlum olurdu.* T.Ş.Simurq. *Dəvə ləpirlərindən, ayaq izindən; Yolların sinəsi oyuq-oyuqdur*. R.Rza. *Oğulsuz-övladsız ocaqlar kimi; Sönüb gedəcəyəm: bu daş, bu torpaq; Bircə ləpirimi yaşatmayacaq*. M.Araz. ☐ **Ləpir tutmaq** – izə düşüb getmək, ləpirlə getmək.

**LƏPİR²** *is. məh*. Ayaqları qısa toyuq cinsi.

**LƏPİRÇİ** *is*. 1. Heyvanı ləpirilə izləyib tapan ovçu; izçi, izaxtaran.

2. Keçmiş bir hadisənin buraxdığı izləri araşdırıb tapan adam.

**LƏPİRƏN** *sif. məh*. Ləpir boyda, ləpir kimi; balaca, ovuc boyda. *Bir azdan sonra dəllək hazır oldu və ləpirən kimi balaca güzgünü ətəyi ilə təmizləyib ustaya təqdim etdi.* Çəmənzəminli.

**LƏRGƏ** *is. bot*. Paxlalılar fəsiləsindən olan, yarpaqcıqları bığcıqla qurtaran bitki.

**LƏRGƏLİK** *is*. Lərgə əkilmiş yer, lərgə tarlası.

**LƏRZAN** *sif.* və *zərf* [*fars*.] *klas*. Lərzə edən, titrəyən, titrək, rəşədar. [Vəzir padşa-

ha:] *Nə ki vardır, həmə lərzandı qabağında sənin; Cürət etməz, ola bir kimsə müxalif əmrin.* Ü.Hacıbəyov. ☐ **Lərzan etmək (qılmaq)** – titrətmək, əsdirmək. *Əsməklə nəsimi-dilbərəfşan; Yarpağı qılır budaqda lərzan*. Xətayi. **Lərzan olmaq** – əsmək, titrəmək.

**LƏRZƏ** *is.* [*fars.*] Titrəmə, titrəyiş, əsmə. ☐ **Lərzə etmək (eyləmək)** – titrəmək, əsmək. **Lərzə salmaq** – dəhşətə gətirmək, vəlvələ salmaq, sarsıtmaq. *Bərk dava oldu. Güllənin səsi dağlara lərzə salmışdı*. "Qaçaq Nəbi". **Lərzəyə düşmək (gəlmək)** – əsmək, titrəmək, hərəkətə gəlmək, sarsımaq. *At Koroğlunu görcək elə kişnədi, elə kişnədi ki, dam-daş lərzəyə gəldi.* "Koroğlu". *Nə qayım durubdur ol sərvqamət; Tərpənəydi, bir lərzəyə gələydi*. M.P.Vaqif. **Lərzəyə gətirmək (salmaq)** – titrətmək, sarsıtmaq. [Ağasəfər] *yerləri lərzəyə gətirən gurultu içində Həmzənin pıçıltısını eşitmək üçün iri başını onun tərəfə əyməyə çalışdı.* Ə.Əbülhəsən.

◊ **Bədəninə (vücuduna, ürəyinə, canına) lərzə düşmək** – qorxudan əsməyə başlamaq, bərk qorxuya, vahiməyə düşmək. *Haşım bu gurultunu eşitdikdə bədəninə lərzə düşdü*. B.Talıblı. *Yasavulbaşı bu köhnə casusu* (*topalı*) *görən kimi canına lərzə düşdü.* M.Rzaquluzadə. **Ürəyinə (vücuduna, canına) lərzə salmaq** – bərk qorxutmaq, dəhşətə gətirmək, qorxuya salmaq. *Bir də ki, mən igid ona deyirəm ki, əsil çətin vaxtda tüfəngi üzünə qaldırmaq ilə qabağındakı düşmənin canına lərzə salsın*. M.Hüseyn.

**LƏRZƏLƏNMƏ** "Lərzələnmək"dən *f.is.*

**LƏRZƏLƏNMƏK** *f.* Lərzəyə gəlmək (düşmək); titrəmək, əsmək.

**LƏRZİŞ** *is.* [*fars.*] b a x **lərzə**. *Tutdu dünyanı od şərarələri; Yaxdı dükkanları, imarələri; Nə'reyi-tündbad, hiddəti-nar; Lərzişi-ərz, sədmeyi-əhcar.* M.Ə.Sabir.

**LƏŞKƏR** *is.* [*fars.*] *köhn*. Qoşun, ordu. *Gəlib qeyzə hökm eylədim ləşkərə; Atın şəhrə üç yandan od bir kərə.* M.Ə.Sabir. [Rəhman Haruna:] *Lap nahaqdan ləşkəri göndərdiniz belə uzaq*. Ü.Hacıbəyov. // Məc. mənada. *Yeriş etdi qəm ləşkəri; Könlüm şəhri talan oldu*. Aşıq Ələsgər.

**LƏŞKƏRGAH** *is.* [*fars.*] *klas*. Ordunun yerləşdiyi yer; ordugah.

**LƏT** [*fars.*] *dan*. 1. *sif.* Ət kimi, süst, key, hərəkətə qadir olmayan, ölgün. *Lət adam. Lət kimi olmaq*.

2. *is.* Heyvanların inkişaf etməsinə mane olan qarın xəstəliyi. *Qoyun lət olub*.

**LƏTAFƏT** *is.* [*ər.*] 1. Lətiflik, yumşaqlıq, xoşluq. [Dərviş Nakamın] *daha səsində köhnə lətafət qalmadı.* Ə.Haqverdiyev.

2. Gözəllik; ruhu oxşayan hal və keyfiyyət, məlahət, qəşənglik. *Bu hüsnü lətafətdə, yəqindir, bəşər olmaz; Rüxsarıva bənzər fələk üzrə qəmər olmaz.* S.Ə.Şirvani. *Bu bağın lətafəti .. oxuculara məlum olduğu üçün tərifinə hacət yox.* C.Cabbarlı. *Bakının yoxsul baharı bütün lətafət və gözəlliyilə gəlmişdi*. S.Hüseyn.

**LƏTAFƏTLİ** *sif.* Zərif, incə, lətif, məlahətli, xoş. *Büllur lətafətlim, sənubər boylum; Huriyü qılmanım, neçün gəlmədi?* M.P.Vaqif.

**LƏTAFƏTLİLİK** b a x **lətafət**.

**LƏTİF** *sif.* [*ər.*] 1. Yumşaq, mülayim, xoş. *Yayın səfalı, lətif bir günü idi*. S.Hüseyn. *Peterburqun bəyaz gecələrinə məxsus lətif yaz havasını ləzzətlə udaraq, bir nəfər oğlan gedirdi.* M.Hüseyn.

2. İncə, zərif, qəşəng. *Çiyninə saldı bir lətif əba; Əlinə aldı bir zərif əsa*. S.Ə.Şirvani. [Bəy:] *Çox razıyam, – deyib əyləşdi və xanım da öz lətif əllərilə ona bir stəkan çay töküb verdi.* Ə.Haqverdiyev.

**LƏTİFƏ[1]** *is.* [*ər.*] *folk*. Həyatdakı, məişətdəki gülməli və məzəli əhvalatlar haqqında yığcam, qısa hekayə, anekdot. *Molla Nəsrəddinin lətifələri*. – [Dərviş Nakam] *birdən görəndə ki, bu söhbət camaatın bir parasına naxoş gəldi, o saat söhbəti dəyişib bir neçə lətifə söylərdi*. Ə.Haqverdiyev. *Vaqif .. Kazıma baxır, ondan yeni bir lətifə eşitmək istəyirdi*. Çəmənzəminli. [Bəhlul:] *Əjdər bizim bölməyə gəlib ucadan .. lətifə söyləyirdi.* B.Bayramov. // Ümumiyyətlə, zarafat, güldürücü qəribə söz, hekayə.

**LƏTİFƏ[2]** *sif.* və *is.* [*ər.*] *klas*. Gözəl, incə, qəşəng (qız və ya qadın). *Əndamı lətifeyi-ilahi; Dəryayi-lətafət içrə mahi.* Füzuli. [Hacı Qənbər:] *Zarafat deyil, səkkiz yaşından indiyə kimi saxlayıb bu dərəcəyə yetirmişəm, belə lətifəni əldən qoysam, mənə axmaq deyərlər.* N.Vəzirov.

**LƏTİFƏÇİ** *is.* Lətifə söyləməkdə mahir olan, gözəl lətifələr danışan; zarafatçı. *Çox razıyam, siz həm gözəl, həm də çox mahir bir lətifəçisiniz.* M.S.Ordubadi.

**LƏTİFƏÇİLİK** *is.* Lətifə söyləməyi sevmə, bacarma; zarafatçılıq. [Vaqifin] *zövq, nəşə və lətifəçiliyi yüksək dərəcəyə çıxmışdı.* Çəmənzəminli.

**LƏTİFLƏŞMƏ** "Lətifləşmək"dən *f.is.*

**LƏTİFLƏŞMƏK** *f.* Lətif olmaq, incələşmək, zərifləşmək, gözəlləşmək.

**LƏTİFLİK** *is.* 1. Yumşaqlıq, mülayimlik, xoşluq, lətafət. *Aylı gecənin lətifliyi.*

2. İncəlik, zəriflik, qəşənglik. *Aşıq, lətiflik güftar iləndir; Əndəlibin meyli gülzar iləndir.* Aşıq Pəri.

**LƏTLƏNMƏ** "Lətlənmək"dən *f.is.*

**LƏTLƏNMƏK** *f.* Ətlənmək, kökəlib ətə dönmək, hərəkət edə bilməmək; atilləşmək. [Kiçikbəyim:] *Ay ana, evdə oturub lətlənməkdənsə bu yaxşıdır: palaza bürün, elnən sürün.* Çəmənzəminli.

**LƏTLƏŞMƏ** "Lətləşmək"dən *f.is.*

**LƏTLƏŞMƏK** b a x **lətlənmək**.

**LƏVAZİMAT** *is.* [*ər.* "ləvazim" söz. cəmi] Bir iş üçün lazım olan şeylərin məcmusu. *Dərs ləvazimatı. Səhnə ləvazimatı. Ov ləvazimatı.* – [Əmiraslan bəy:] *Dəstələr toplayınız, ləvazimat cəm ediniz.* S.S.Axundov. *Böyükxanım qabaqca hamam ləvazimatını Qulam Hüseyn ilə hamama göndərmişdi.* M.S.Ordubadi. *Ləmənin küncləri böyük düşbərəxor və bu kimi ev ləvazimatı ilə bəzənərdi.* H.Sarabski.

**LƏVƏND** *is.* və *sif. dan*. [*ital*. levantino] Əxlaqsız, pozğun (adətən söyüş yerində işlənir). *Ləvəndə qoşulan bəlayə düşər.* (Ata. sözü). [Naçalnik:] *Ə, ləvənd oğlu, ləvənd! Sən nə hətərən-pətərən sözlər danışırsan?!* "Qaçaq Nəbi". [Qayınana:] [Onlar] *həyasız-abırsız, özündən sərxoş ləvəndlərdir.* C.Cabbarlı.

**LƏVƏNGİ** *is.* İçi qoz, turşu və s. doldurulmuş balıq və ya quşla hazırlanmış xörək.

**LƏYAQƏT** *is.* [*ər.*] 1. İnsanda yüksək mənəvi keyfiyyətləri göstərən xassələrin məcmusu, həmçinin bu xassələrin dəyərini dərk edən şəxsin özünə qarşı duyduğu ehtiram hissi. *Yüksək insani ləyaqət. – Ağlı mədəsindən xırda gədələr; Dünyanı yedirdi öz niyyətinə; Kəsib tamahından ulu dədələr; Caladı həmişə ləyaqətinə.* B.Vahabzadə.

2. Qabiliyyət, bacarıq, istedad, iqtidar. [Həsən ağa:] *Baxım görüm nəyə ləyaqətləri var, bir əməlli qulluğa qoyum, işləsinlər.* Ə.Haqverdiyev. *Baharın xasiyyətini, ləyaqətini və evdarlığını Rəhimə bəyənib evin cəmi ixtiyarını ona verdi.* S.S.Axundov.

3. **Ləyaqətlə** şəklində *zərf* – 1) layiqli bir surətdə, layiq olduğu tərzdə. *Ləyaqətlə qarşılamaq. Ləyaqətlə cavab vermək. – Nə qədər ki, gec deyil, qayıt bu yoldan, qafil; Ləyaqətlə ölməyi ömrün hünər tacı bil!* X.Rza; 2) bacarıqla, lazımınca. *Tapşırığı ləyaqətlə yerinə yetirmək.*

**LƏYAQƏTLİ** *sif.* 1. Ləyaqəti olan, layiq. *Mükafata ləyaqətli işçi.* // Layiqli, hörmətli. [Qazı Xudayar bəyə:] *Əgər səndən bədgüman və naümid olsa idim, heç bu qədər danışmağa durmaz idim sənnən. Amma xeyr, maşallah, artıq ləyaqətli adamsan.* C.Məmmədquluzadə.

2. Qabiliyyətli, bacarıqlı, istedadlı, iqtidarlı. *Qafar .. İkram və Fatma kimi zehinli, ləyaqətli uşaqlar böyüdüb yetirən arvadına güldən ağır söz deyilməsinə dözməyəcəkdi.* Ə.Əbülhəsən.

**LƏYAQƏTLİLİK** *is.* Ləyaqəti olma, ləyaqətli olma; bacarıqlılıq, qabiliyyətlilik.

**LƏYAQƏTSİZ** *sif.* 1. Layiq olmayan, ləyaqəti olmayan; layiqsiz, nalayiq. *Südabəyə layiq bir şey almaq üçün* [Qəhrəmani və Firidunun] *pulu çatmazdı, ləyaqətsizini* (is.) *də aparmaq mənasızdı*. M.İbrahimov. [Qadir] *.. qeyzli-qeyzli bu ləyaqətsiz sözləri də əlavə etdi*. Ə.Əbülhəsən.

2. Qabiliyyətsiz, bacarıqsız, istedadsız. *Ləyaqətsiz adamları diri hesab etmə.* "Qabusnamə".

**LƏYAQƏTSİZLİK** *is.* Layiq olmayan şey və hərəkət; ədəbsizlik, nalayiqlik.

**LƏYƏN** *is.* Müxtəlif ehtiyaclar – içində əl-üz və ya paltar yumaq, mürəbbə bişirmək və s. üçün istifadə edilən misdən və ya başqa materiallardan qayrılmış müxtəlif şəkilli dərin qab. [Molla] *həmişə ətəyinin altında da bir ləyən gətirib, onu da plovla doldurub evə aparır.* Ə.Haqverdiyev. *Qapının yanında,*

*ləyənin içində çoxlu təzəcə yuyulmuş paltar vardı.* S.Rəhman. *Sərvnaz qarı cəld su qızdırıb Nəcəfalı kişinin keyimiş ayaqlarını ləyənə saldı.* B.Bayramov.

**LƏYƏNÇƏ, LƏYƏNCİK** *is.* Balaca ləyən, kiçik ləyən. *Qoyun ətinin qiyməsi kiçik bir ləyənçədə dodaqbadodaq idi.* Ə.Vəliyev.

**LƏZGİ** *is.* Dağıstanda və Azərbaycanda yaşayan Dağıstan xalqlarından biri və bu xalqa mənsub adam. *Kimsən, haralısan? Danış, ay çoban: – Dağıstan əhliyəm, ləzgiyəm, qardaş!* S.Vurğun.

**LƏZGİCƏ** *sif.* və *zərf* Ləzgi dilində. *Ləzgicə kitab. Ləzgicə danışmaq.*

**LƏZGİHƏNGİ** *is.* İti oynanılan Dağıstan oyun havalarından birinin adı.

◊ **Ləzgihəngi oynamaq (vurmaq)** *məc.* – çox sevinmək, sevincdən atılıb-düşmək. *Molla Yusifin gətirdiyi fitvaları oxuyub şadlıqlarından ləzgihəngi oynayırlar.* Ə.Haqverdiyev. [Salman bəy:] *Bayaqdan başını tərpədə bilmirdin, indi ləzgihəngi vurursan.* N.Vəzirov.

**LƏZGİXİNGALI** *is.* Ət və ya qovrulmuş soğanla bişirilən sulu xingal.

**LƏZGİNKA** *is.* bax **ləzgihəngi**. *Həpsi birdən halqa vurdu; Coşqun məclis quruldu; Çalğı coşdu, incə, şaqraq ləzginkalar vuruldu.* A.İldırım.

**LƏZİZ** *sif.* [*ər.*] bax **ləzzətli** 1-ci mənada. *Ləziz yeməklər. – Bəli, nəməklə olur rəsmdir kəbab ləziz!* S.Ə.Şirvani. *O qədər ləziz xörəklər ki, bircə ramazan aylarında ortalığa gəlir, qeyri on bir ayın ərzində gəlmir.* C.Məmmədquluzadə. [Qəmər:] *Gör sənə bacın badımcandan, pomidordan nə dürlü-dürlü, ləziz xörəklər bişirəcəkdir.* S.S.Axundov.

**LƏZZƏT** *is.* [*ər.*] 1. Yeyilən, içilən hər hansı bir şeydən duyulan xoş hiss; tam, dad. *Hər xörəyin bir ləzzəti var. Bu meyvənin ləzzəti necədir? Ağzımın ləzzəti qalmışdır.* // Dadlılıq, şirinlik. *Ləzzəti hələ də damağımdadır. Bu əncirin ləzzətindən keçmə.*

2. *məc.* Bir şeydən duyulan xoş hiss, sevinc duyğusu; həzz, nəşə. *İlin hər fəslinin bir hüsnü var, amma qışın ləzzəti bir özgədir.* C.Məmmədquluzadə. *Olunca kefin kök, yollar da hamvar; Qızışmış atlarda başqa ləzzət var.* Ə.Cavad. *Ov da olmasa, elə bunun tamaşası, özü bir ləzzətdir.* M.Rzaquluzadə.
□ **Ləzzət almaq (aparmaq, görmək, çəkmək)** – həzz almaq, zövq almaq, xoşuna gəlmək, xoşlanmaq. [Əmrah:] *İndi bəylə xanım vuruşacaq, ləzzət aparacağam.* Ə.Haqverdiyev. *Rüstəm kişi tütünün ətrindən, saçaqlı tellərinin rəngindən xüsusən ləzzət alardı.* M.İbrahimov. **Ləzzət vermək** – xoşlandırmaq, zövq vermək, həzz vermək. *..Meşədən axan bulaqların səsi və gərdişin comərdliyi Bahadıra böyük ləzzət verirdi.* N.Nərimanov. *Quzuçuların həvəslə oynamaları, quzuların iştaha ilə otlamaları Gurşada ləzzət verirdi.* Ə.Vəliyev. **Ləzzətdən düşmək** – əvvəlki dad və təravətini itirmək. **Ləzzəti qaçmaq (getmək)** – əvvəlki ləzzəti, zövqü verməmək, təsirdən düşmək. *Daha bu işin ləzzəti qaçdı.* **Ləzzətini görmək** – bir şeyin zövqünü, nəşəsini hiss etmək, duymaq. *Tələbəliyin ləzzətini görmək. – Nəbi nökərçiliyin ləzzətini gördüyü üçün rəncbərlik etmək fikrinə düşür.* "Qaçaq Nəbi". [Uşaq:] *Məni istəyirsən, dur gedək babamın otağına, biz də ata və ana ilə bir yerdə çörək yemək ləzzətini görüb fərəh edək.* M.S.Ordubadi.

3. **Ləzzətlə** şəklində *zərf* – xoşlana-xoşlana, həvəslə, iştaha ilə. *..Xudayar katda ləzzətnən yıxılıb yatdı.* C.Məmmədquluzadə. [Ramazan] *nahar üçün hazırlanmış südlü plovu ləzzətlə yeyir*(*di*).. M.Hüseyn.

**LƏZZƏTLƏNDİRMƏ** "Ləzzətləndirmək"-dən *f.is.*

**LƏZZƏTLƏNDİRMƏK** *f.* Ləzzətini artırmaq, ləzzətli etmək, dada gətirmək, dadlandırmaq. *Ədviyyə xörəyi ləzzətləndirir. – Fərəhlə yediyi xörəyin də ləzzətləndiyini duyan Nazlının, bacısı Tamam yadına düşməsilə qəlbi qaralmışdı.* Ə.Əbülhəsən.

**LƏZZƏTLƏNMƏ** "Ləzzətlənmək"dən *f.is.*

**LƏZZƏTLƏNMƏK** *f.* Daha ləzzətli olmaq, ləzzəti, dadı artmaq; dadlanmaq.

**LƏZZƏTLİ** *sif.* 1. Ləzzət verən, dadlı, yeməli, tamı gözəl. *Ləzzətli xörək. Ləzzətli yeməklər. – Məşədi İmaməli çox ləzzətli plova və bal qayğanağına bizi qonaq elədi.* C.Məmmədquluzadə. *Xörəklər olduqca lətif və ləzzətli idi.* M.S.Ordubadi. *Bütün nahar dəstgahı qızıl qablarda gəldi; Qızıl piyalələrdə ləzzətli mey verildi.* B.Vahabzadə.

2. *məc.* Xoşagələn, xoş. *Sözü ləzzətli, şirindilli uşaqdır uşağım; Nə ədəb vaxtıdı, qoy söysün, uşaqdır uşağım!* M.Ə.Sabir. [Əhməd:] *Xeyr aa, elə adam deyil, ləzzətli oğlandır*. N.Vəzirov.

3. *məc.* Ürəyəyatan, zövqverən, xoşagələn; xoşlanılacaq, şirin. *Ver pulunu dadlı, ləzzətli zad al! Qoy babalın boyuma, get arvad al!* M.Ə.Sabir. *Ləzzətli xəyalatdan, bir söz də olsa, Əhməd yadında bir şey saxlamamışdı.* B.Talıblı.

**LƏZZƏTSİZ** *sif.* Ləzzəti olmayan, dadsız, dadsız-tamsız. *Ləzzətsiz yemək*. – *İçki yıxmış bütün əsabın, rəngi saralıb; Ömrü sərxoşluq ilə badə gedib ləzzətsiz.* A.Səhhət.

**LƏZZƏTSİZLİK** *is.* Ləzzəti, dadı olmayan şeyin hal və keyfiyyəti. *Xörək ləzzətsizliyi üzündən yeyilmədi.*

**LIĞ** b a x **lıqqa**. [Firidun bəy:] *Gözünə döndüyüm, faytonu tərpədib böyründən nə tövr ilişdirdisə, təpəsi üstə getdi lığın içinə, ürəyi getdi.* Ə.Haqverdiyev.

**LIĞA** *is.* Qatı, mət, qəliz. [Mirzə] *gecələr qamış qələmi mürəkkəbin lığasına basıb, yavaş-yavaş yazar, lakin kəlamını kimsəyə oxumaz.* Çəmənzəminli.

**LIĞLANMA** "Lığlanmaq"dan *f.is.*

**LIĞLANMAQ** *f.* Lığ halına gəlmək, lığ olmaq. *Yağışın suyu lığlanıb.*

**LIĞLAŞMA** "Lığlaşmaq"dan *f.is.*

**LIĞLAŞMAQ** b a x **lığlanmaq**.

**LIQQA** *is.* Yağmurdan, sulu qardan yerdə əmələ gələn duru palçıq; batdaq, lehmə.

**LIQQILDAMA** "Lıqqıldamaq"dan *f.is.*

**LIQQILDAMAQ** *f.* Lıqqıltı ilə qaynamaq (samovar, çaynik, su və s.). *Çaynik lıqqıldayır.*

**LIQQILDATMA** "Lıqqıldatmaq"dan *f.is.*

**LIQQILDATMAQ** *f.* İçərisində maye olan qabı tərpədib lıqqıltı səsi çıxartmaq. *Südqabını lıqqıldatmaq*.

**LIQQILTI** *təql.* İçərisində maye olan qabı tərpətdikdə çıxan səs, lıqqıldama səsi.

**LIRÇILDAMA** "Lırçıldamaq"dan *f.is.*

**LIRÇILDAMAQ** *f.* Lırçıltı səsi vermək, lırçıltı səsi çıxarmaq.

**LIRÇILTI** *təql.* Palçığa, batdağa və b. qəliz şeyə batıb çıxan bir şeydən hasil olan səs.

**LIRT** *sif.* 1. Çox döyib sulanmış. *Lırt armud. Lırt əzgil*.

2. *məc.* Süst, ət kimi boş. *Lırt olmaq* (süst olmaq, əzginləşmək, süstləşmək).

**LIRTQARIN** *sif. dan*. Böyük və sallaq qarnı olan. *Lırtqarın adam.*

**LIRTLIQ** *is.* 1. Lırt şeyin (adamın) halı.

2. *məc.* Boşluq, süstlük, əzginlik.

**LIRTMAC** b a x **lıqqa**.

**LİANA** [*fr.*] *bot*. Tropik meşələrdə, Qafqaz meşələrində bitən iri sarmaşıq, bitki.

**LİBAS** *is.* [*ər.*] 1. Paltar, geyim. *Səfər libası. Toy libası. Dərviş libası. Hərbi libas.* – *Pənbeyi-daği-cünun içrə nihandır bədənim; Diri olduqca, libasım budur, ölsəm kəfənim*. Füzuli. [Mirzə] *durub, libasını geyinib, getdi Zeynalın dükanına*. Ə.Haqverdiyev.

2. *məc.* Örtük mənasında. *Dərələr, təpələr bozumtul bir libas geymişdi*. M.Hüseyn.

**LİBASLI** *sif.* Paltarlı, geyimli. [Qəhrəman:] *Qara libaslı bir kişi qapının qıfılını sındırmağa məşğul idi.* H.Nəzərli.

**LİBASSIZ** *sif.* və *zərf* Paltarsız. *Neçə vaxtdan sonra işin üstü açıldı. Həqiqətən bir seyid qızı haman günü məşədinin evinə libassız əyləşibmiş, o da məşədinin öz arvadı imiş.* Ə.Haqverdiyev.

**LİBERAL** [*lat*. liberalis – azad] 1. Liberalizm (1-ci mənada) tərəfdarı.

2. Liberal partiyalardan birinin üzvü.

3. *məc. dan*. Liberallıq göstərən, zərərli bir işə kömək edən adam, barışdırıcı, güzəştçi.

**LİBERALCASINA** *sif.* və *zərf* Liberala (2-ci mənada) xas olan bir tərzdə, liberal kimi, liberallıq göstərərək. *Liberalcasına münasibət.*

**LİBERALİZM** [*lat.*] 1. Feodal təhkimçilik dövründə və burjua inqilabları zamanı burjuaziya üçün azadlıq tələb edən, onun siyasi hakimiyyəti qurulduqdan sonra isə son dərəcə mürtəce bir mahiyyət kəsb edən siyasi cərəyan.

2. *köhn.* Azadfikirlilik.

3. *məc. dan.* Lüzumsuz yumşaqlıq, rəhmdillik, mərhəmət göstərmə; güzəştə getmə, yumşaqlıq göstərərək zərərli bir işə yol vermə. *İmtahan sessiyasında heç bir liberalizmə yol verilməməlidir*.

**LİBERALLAŞMA** "Liberallaşmaq"dan *f.is.*

**LİBERALLAŞMAQ** *f.* 1. *köhn.* Liberal olmaq, liberal bir şəkil (hal) almaq; demokratlaşmaq, azadfikirli olmaq.

2. *dan.* Möhkəmliyini, sabitliyini itirmək, liberalizmə (3-cü mənada) qapılmaq.

**LİBERALLIQ** b a x **liberalizm** 3-cü mənada. ☐ **Liberallıq göstərmək** – lüzumsuz yerə yumşaqlıq (rəhmdillik) göstərmək, pis işlərə göz yummaqla onlara yol vermək.

**LİBERTİ** [*ing.*] İpək və ya ipək qarışıq yumşaq, parıltılı parça növü. *Liberti çarşab. Liberti köynək.*

**LİBİDO** *is.* [*lat.*] 1. Psixoanalizin əsas anlayışlarından biri, şüursuz cinsi həvəs.

2. Psixi energiya.

**LİBRÉTTO** [*ital.*] 1. Böyük musiqi-vokal əsərinin (opera, operetta, oratoriya) mətni. "*Şahsənəm*" *operasının librettosunu Cəfər Cabbarlı yazmışdır.* // Operanın və ya pyesinin qısa məzmunu (adətən teatr proqramında çap edilir).

2. Balet, ya kinofilmin ssenarisinin planı.

**LİBRETTOÇU** *is.* Libretto yazan şəxs, libretto müəllifi.

**LİCİM** *is. dan.* Biçim, görkəm, təhər-töhür, üst-baş. *Bunun licimini görürsən?! O danışanda nə təhər də gülür! – deyə iki əlilə döşünü sıxıb geriyə çəkildi.* S.Rəhimov. ☐ **Licimi axmaq** *dan.* – səliqəsiz, yaraşıqsız geyinmək, üst-başı tökülmək.

**LİDER** [*ing.* leader – başçı] 1. Siyasi partiyanın, ictimai-siyasi təşkilatın və s. başçısı, rəhbəri. *Parlament fraksiyasının lideri. – Hər lider özünün mənsub olduğu partiyanın əqidəsi uğrunda uzun nitq söyləyirdi.* M.S.Ordubadi.

2. Hər hansı bir yarışda: birinci yerdə gedən adam və ya komanda. *Şahmat yarışının lideri.*

**LİDERLİK** is. 1. Liderin mövqeyi, vəzifəsi. // Liderin fəaliyyəti; başçılıq.

2. Hər hansı yarışda birincilik. *Liderlik uğrunda mübarizə.*

**LİF**[1] *is.* [*ər.*] Pambığın, baramanın incə saçaqları, ipliyi. *Pambıq lifi.*

**LİF**[2] *is.* Bədəni sabunlayıb çirkini aparmaq üçün nazik parçadan tikilmiş və ya toxunmuş kisəcik. [Həkim:] *Uşağın özü çox zəif və bədəni də çox çirklidir.. Yerinin içində lif və sabun ilə bədənini təmizləmək lazımdır.* S.S.Axundov.

**LİFAYIRAN** *sif. xüs.* Pambıq, barama və s. liflərini ayıran. // *İs. mənasında.* Pambıq, barama və s. liflərini ayıran maşın. *Lifayıranı təmir etmək.*

**LİFÇİ** *is.* Hamamda lif çəkən adam; kisəçi.

**LİFƏ** *is.* Şalvarın, dizliyin, tumanın içərisindən bağ keçirilən bel hissəsi.

**LİFƏLİ** *sif.* Lifə tikilmiş, lifəsi olan. *Lifəli dizlik. Lifəli tuman. – Həmişəki kimi* [Şahbaz bəy] *yenə də müsəlmanı deyilən lifəli şalvar, qara, gahlı arxalıq geymişdi.* Ə.Əbülhəsən.

**LİFGİR** *is.* [*ər.* lif və *fars.* ...gir] *köhn.* b a x **lifçi**. *Hacı Əbdül hamamında hamı lifgir, camadar; Altı aydır, gecələr məşq qılar, növhə yazar.* M.S.Ordubadi.

**LİFGİRLİK** *köhn.* b a x **lifçilik**.

**LİFLƏMƏ** "Lifləmək"dən *f.is.*

**LİFLƏMƏK** *f.* Liflə bədəni yumaq, bədənə lif sürtmək. *Özünü lifləmək.*

**LİFLƏNMƏ** "Liflənmək"dən *f.is.*

**LİFLƏNMƏK** *qayıd.* Liflə yuyunmaq, bədəninə lif sürtmək. *Liflənib qurtarmaq.*

**LİFLİ** *sif.* Tərkibində lif olan, liflərdən ibarət. *Nazik lifli pambıq. Lifli parça. Lifli bitki.*

**LİFT** [*ing.* lift] Çoxmərtəbəli binalarda, şaxtalarda adam və yük qaldırıb-düşürmək üçün maşın. *Təyyarəçi, mexanik və miniklər təyyarədən çıxıb liftə oturdular.* Çəmənzəminli. *Gəzə-gəzə restorana gedəndə də, liftə minib on ikinci mərtəbəyə qalxanda da, Orxan yalnız Yavərlə Fidan barədə düşündü.* İ.Məlikzadə.

**LİFTÇİ** *is.* Liftdə işləyən, lifti idarə edən adam.

**LÍXTER** *is.* [*holl.*] Yedəyə alınan yük gəmisi.

**LİKÖR** [*fr.* liqueur] Tünd, şirin, ətirli spirtli içki. [Pişxidmət] *..Firəngistanın ən gözəl likörlərindən neçə növünü masanın üstünə qoydu.* Ə.Haqverdiyev. [Qonaqlıqda] *likör və qəhvə içilirdi.* M.S.Ordubadi.

**LİQÁ** *is.* [*ər.*] *klas.* Üz, çöhrə, sima, sifət. *Nə gözəlsən, nə xoş liqasən sən; Yeri var söyləsəm humasən sən.* M.Ə.Sabir. [Dərviş:] *İki gecənin arasından bədirlənmiş ay parası kimi bir hürizadın liqasını gördüm.* A.Divanbəyoğlu.

**LİQAF** *is.* Heyva və s. meyvələrin toxumunun üzərində olan yumşaq və ağ maddə.

**LİQNÍT** [*lat.*] Aşağı keyfiyyətli boz kömür.

**LİQROÍN** [*fr.*] Neft emalı zamanı alınan məhsullardan biri; neft spirti.

**LİL[1]** *is.* 1. Dənizin, gölün, çayın dibində olan mineral və ya üzvi hissəciklərdən ibarət çöküntü.

2. Bulanıq suların dibinə çökmüş qara, duru palçıq; lehmə, batlaq. *Gəlinlərin balağı; Batır lilə, batlağa.* A.Səhhət. *Bu çay özü ilə daima lil gətirib, ətrafı batırırdı.* S.Rəhimov. // Lilli. *Çayın lil suyu burula-burula, yavaş-yavaş axıb gedirdi.* C.Məmmədquluzadə.

**LİL[2]** *is.* Yuyulmuş ağ paltarın rəngini qaytarıb təzələmək üçün ona vurulan göy boyaq; sinka. *Suya lil qatmaq.*

**LİLİPÚT** [ingilis yazıçısı Sviftin "Qulliverin səyahəti" romanındakı əfsanəvi Liliputlar ölkəsinin balacaboylu sakinlərinin adından] Qeyri-normal, kiçikboylu adam; cırtdan. // *məc.* Çox kiçik həcmli şey haqqında.

**LİLİPUTLUQ** *is.* Liliput adamın xüsusiyyəti, boyca kiçiklik, balacalıq; cırtdanlıq.

**LİLLƏMƏ** "Lilləmək"dən *f.is.*

**LİLLƏMƏK** *f.* Lil vurmaq, lilli suya salmaq; sinkalamaq. *Paltarı lilləmək.*

**LİLLƏNDİRİLMƏ** "Lilləndirilmək"dən *f.is.*

**LİLLƏNDİRİLMƏK** *məch.* Bulandırılmaq, lilli edilmək. *Su lilləndirilib.*

**LİLLƏNDİRMƏ** "Lilləndirmək"dən *f.is.*

**LİLLƏNDİRMƏK** *f.* Duru suyu bulandırmaq, lilli etmək. *Su axar, lilləndirər; Bağçanı gülləndirər; Dərdliyə söz deməyin; Dərd onu dilləndirər.* (Bayatı).

**LİLLƏNMƏ[1]** "Lillənmək[1]"dən *f.is.*

**LİLLƏNMƏ[2]** "Lillənmək[2]"dən *f.is.*

**LİLLƏNMƏK[1]** *f.* 1. Bulanmaq, bulanıq hala gəlmək. *Gah köpüklənib lillənən, gah çılğın kimi dillənən; Bəzən sakit-sakit axıb; Gündüz kimi durulan Kür!* R.Rza. *Yağış yağar, sular daşar, dillənər; Ürək anar yenə keçən günləri.* M.Dilbazi. *Dağ suları dağdan enər; Nə bulanar, nə lillənər.* B.Vahabzadə.

2. Dibində lil, çöküntü əmələ gəlmək. *Kanal lillənib.*

**LİLLƏNMƏK[2]** Lil vurulmaq, lilli suya salınmaq. *Balışın üzü lillənib.*

**LİLLƏNMİŞ** *f.sif.* Lil vurulmuş, lilli suya salınmış. *Lillənmiş köynək.*

**LİLLƏŞMƏ** "Lilləşmək"dən *f.is.*

**LİLLƏŞMƏK** b a x **lillənmək**.

**LİLLİ[1]** *sif.* Lehməli, bulanıq, batlaqlı, palçıqlı, lil qarışıq. *Lilli çay. Lilli göl. – Lilli gölməri qurudan ellər; Kəhriz sularının gözündən içər.* S.Vurğun. *Bəlkə bu lilli sular axdı, heç durulmadı; Onu görmək bir daha mənə qismət olmadı.* B.Vahabzadə.

**LİLLİ[2]** *sif.* Lil vurulmuş; sinkalı. *Lilli paltar.*

**LİLLİLİK** *is.* Lilli olma; lehməlilik, bulanıqlıq. *Suyun lillilik dərəcəsi.*

**LİLPAR** *is. bot.* Sulu yerlərdə bitən yarpaqlı ot bitkisi. *Çayın vadisi dərə boyu yamyaşıl bir zeh kimi uzanıb gedir və yuxarılarda gözdən itirdi. Qara bulaqların axarınca acı tərələr, lilparlar, yarpızlar bitmişdi.* İ.Şıxlı.

**LİMÁN** [*yun.*] 1. Sahil boyunda qurunun tədricən çökdüyü yerlərdə dəniz suyunun geniş çay mənsəblərini basması nəticəsində əmələ gələn dayaz dəniz körfəzi. *Əgər fəhlələr sürətlə gedən katerə minsəydilər, Qara daşlarla liman arasındakı məsafəni beş saata qət edə bilərdilər.* M.Hüseyn.

2. Okean, dəniz və daxili su hövzələrinin sahilində gəmilərin durması və yük vurulub boşaldılması üçün körpü və başqa qurğularla təchiz olunmuş məntəqə; port. *Yalnız küçələrdə deyil, limanda da qələbəlik vardı.* M.Hüseyn. *Limanın yaxınlığında* [Dürrə] *addımlarını yavaşıtdı.* S.Vəliyev.

**LİMANÇI** *is.* Limanda işləyən adam, liman işçisi. *Limançıların əmək müvəffəqiyyətləri.*

**LÍMFA** [*lat.* lympha – təmiz su] *fiziol.* İnsan və onurğalı heyvan orqanizminin hüceyrəarası boşluqlarını dolduran, bütün toxuma və hüceyrələrinə qida daşıyan şəffaf maye. *Limfa, qan kimi plazmadan* (*maye hissədən*) *və formalı elementlərdən* (*limfositlərdən*) *ibarətdir, özü də rəngsizdir.* K.Balakişiyev.

**LİMFATİK** *sif.* [*lat.*] Limfaya aid olan. *Limfatik sistem. Limfatik vəzi.*

**LİMFOSİTLƏR** [*lat.* lympha – təmiz su və *yun.* kytos – hüceyrə] *fiziol.* İnsan və onur-

ğalı heyvanların orqanizmində ağ qan hüceyrələri növlərindən biri.

**LİMİT** [*lat*. limites – sərhəd] Bir şeyi işlətmək, bir şeydən istifadə etmək üçün icazə verilən norma, miqdar; son hədd. *Kredit limiti. Limiti artırmaq*.

**LİMİTLƏMƏ** "Limitləmək"dən *f.is.*

**LİMİTLƏMƏK** *f.* Limit, hədd, dərəcə təyin etmək, norma müəyyənləşdirmək.

**LİMİTLƏNMƏ** "Limitlənmək"dən *f.is.*

**LİMİTLƏNMƏK** *f.* Hər hansı bir şeyin işlədilməsinə hədd, dərəcə təyin edilmək, norma qoyulmaq.

**LİMİTLƏŞDİRMƏ** "Limitləşdirmək"dən *f.is.*

**LİMİTLƏŞDİRMƏK** *f.* Hər hansı bir şeyin işlənməsinə hədd, dərəcə təyin etmək, norma qoymaq. *Aztapılan mallar limitləşdirilmişdir*.

**LİMİTLƏŞMƏ** "Limitləşmək"dən *f.is.*

**LİMİTLƏŞMƏK** b a x **limitlənmək**.

**LİMON** *is.* [*yun.*] Subtropik yerlərdə bitən həmişəyaşıl sitrus ağacı və bu ağacın yumurtaşəkilli turşməzə, sarı meyvəsi. *Çaya limon salmaq. Limon şirəsi.* ☐ **Limon rəngi** – açıq-sarı rəng. *Limon rəngində parça. – Qəhrəmanın rənginə bir sarılıq çökdü. Sifəti limon rəngində oldu*. Ə.Vəliyev. **Limon turşusu** – əsasən limonun və bəzi başqa meyvələrin tərkibində olan turşu (kulinariyada, tibdə və s.-də işlədilir). *Xörəyə limon turşusu tökmək.*

**LİMONÁD** [*fr.*] Tərkibində limon və ya başqa meyvə şirəsi olan sərinlədici şirin içki. *Limonad zavodu. Bir stəkan limonad içmək. – Ələsgər dayı gedib yol üçün iki butulka limonad aldı*. İ.Əfəndiyev.

**LİMONÇU** *is.* Limon ağacı əkib-becərməklə məşğul olan adam, mütəxəssis.

**LİMONÇULUQ** *is.* Limon əkib-becərməklə məşğul olma.

**LİMONLU** *sif.* 1. Limon ağacı əkilmiş, limon ağacı olan. *Limonlu həyət. – Odur ki, arvad, azı on min evdə bahar düzəltmişəm, sarı limonlu bağçalar salmışam, gül-gülüstan yaratmışam, ad qazanmışam*. S.Rəhimov.

2. İçərisinə limon salınmış. *Limonlu şərbət. – Söhbətin bu yerində çayçı Qurban iki stəkan limonlu çay gətirdi.* H.Nəzərli. // Tərkibində limon şirəsi olan, limon dadı (qoxusu) verən. *Limonlu konfet.*

**LİMONLUQ** *is.* Limon ağacları əkilmiş yer. *Limonluğu belləmək.*

**LİMUZÍN** [*fr.*] Üstüörtülü minik avtomobili növü.

**LİNC** *sif.* 1. *aşp*. Dəm almayıb bir-birinə yapışan düyü. *Gülmə gülünc olana; Bir aşı linc olana; Gülürsən də gülgilən; Qulağı dinc olana.* (Bayatı).

2. *dan*. Günəşdən, yorğunluqdan əzgin və zəif hala düşmə, süst olma. *Linc olmaq*.

**LİNCLİK** *is. dan*. Günəşdən, yorğunluqdan əzginlik, ölgünlük, süstlük.

**LİNÇ: Linç məhkəməsi** – ABŞ-da adətən zəncilərə və inqilabçı fəhlələrə vəhşicəsinə divan tutma, məhkəməsiz cəza vermə (XVIII əsrdə yaşamış irqçi Ç.Linçin adından).

**LİNÇLƏMƏ** "Linçləmək"dən *f.is.*

**LİNÇLƏMƏK** *f.* Linç məhkəməsi üsulu ilə cəzalandırmaq, amansızcasına divan tutmaq.

**LİNÇLƏNMƏ** "Linçlənmək"dən *f.is.*

**LİNÇLƏNMƏK** *məch.* Linç məhkəməsi üsulu ilə cəzalandırılmaq, amansızcasına divan tutulmaq.

**LİNG** *is.* Ağır şeyləri qaldırmaq, bərk yeri qazımaq və başqa məqsədlər üçün istifadə edilən bir ucu şiş, bir ucu isə iti, uzun, ağır dəmir alət. *Bu zaman əllərində ling və çəkic olan ikinci bir başıpozuq dəstə göründü*. A.Şaiq. *Bunlardan bəziləri əllərində ling iri daşı yerindən qoparıb tərpədir və "xəbərdar!" – deyib, çayın içinə yumalayırdılar*. Ə.Vəliyev.

◊ **Ling vurmaq (gəlmək, salmaq)** – b a x **iş vurmaq** ("**iş**"də) [Hacı Əhməd:] *..Şərif haranın itidir ki, mən dura-dura mənim adamıma əlaltı ling vursun*. C.Cabbarlı.

**LİNGCİK** *is*. Kiçik ling, balaca ling. *Lingciklə işləmək.*

**LİNGLƏMƏ** "Lingləmək"dən *f.is.*

**LİNGLƏMƏK** *f.* Linglə qaldırmaq, altına ling salaraq yerindən tərpətmək. *Daşı linglәmək.*

**LİNG-LİNGİ** *is.* Bir ayaq üstə atıla-atıla oynanılan uşaq oyunu.

**LİNKÓR** [*rus*. "линейный корабль" ixtisarı] Dəniz döyüşündə müxtəlif gəmi növlərini məhv etmək və düşmənin sahil obyektlərinə artilleriya zərbəsi endirmək üçün güclü silahlarla silahlanmış iri hərb gəmisi.

**LİNQAFON** *is.* [*lat.*] Qrammofon vallarına və ya maqnitofon lentlərinə yazılmış dil kursu.

**LİNOLEUM** [*lat.* linum – kətan və oleum – yağ] Döşəmə üçün polimer örtük materialı.

**LİNOLEUMLU** *sif.* Linoleumla örtülmüş, linoleum vurulmuş. *Linoleumlu döşəmə.*

**LİNOTİ́P** [*lat.* – linea – xətt və *yun.* typos – iz, surət] *mətb. köhn*. Kitab, jurnal və qəzet mətnlərini yığmaq üçün qurğuşundan sətirtökən yığı maşını. // Həmin maşında hazırlanmış sətirşəkilli monolit metal tökmələr.

**LİNOTİPÇİ** *is.* Linotipdə işləyən mətbəə işçisi.

**LİNOTİPÇİLİK** *is.* Linotipçinin işi, sənəti.

**Lİ́NZA** [*alm.*] bax **ədəsə** 2-ci mənada. *Qabarıq linza. Silindrik linza.*

**LİNZALI** *sif.* Linzanın tətbiqilə əlaqədar olan, linzası olan. *Linzalı cihazlar*.

**LİPOİD** *is.* [*yun.*] Təbii yağa bənzəyən maddə.

**Lİ́RA** [*yun.*] Barmaqla çalınan qədim yunan simli musiqi aləti; rübab.

**Lİ́RƏ** [*ital.*] Türkiyədə, İtaliyada və bəzi başqa ölkələrdə pul vahidi.

**LİRİK**[1] [*yun.*] Lirik şeirlər yazan şair, lirik şeirlər müəllifi.

**LİRİK**[2] *sif.* [*yun.*] 1. Lirika xüsusiyyətləri olan, lirika mahiyyətində olan (bax **lirika** 1-ci mənada). *Lirik poeziya*.

2. Lirizmlə dolu, hiss və həyəcanla dolu; emosional. *Lirik şeir. Lirik musiqi. Lirik səhnə. – İlk qələm təcrübəsi zamanı yazdığı lirik parçalarda ifadə olunan bəzi meyilləri pisləyərək,* [S.Vurğun] "*Ölən şeirlərim*" *adlı şerini yazır.* M.Arif. [Ü.Hacıbəyov] *öz komediyalarında komik vəziyyətlərlə bərabər lirik və dramatik səhnələr də yaradır.* Ə.Sultanlı.

3. *mus.* Həzin, mülayim, zərif, xoş (səs haqqında). *Lirik tenor. Lirik soprano. – Onun yumşaq, lirik səsi o qədər çox şöhrət qazandı ki, adı gələndə xanəndələr ayağa qalxmağa başladılar*. S.Rəhman.

◊ **Lirik ricət** – bədii əsər süjetinin, mövzusunun, gedişinin ardıcıllığı xəttini qıran hiss və həyəcanla dolu ricət.

**LİRİ́KA** [*yun.* lyrikos – liranın müşayiəti ilə oxunan] 1. Şairin hiss və həyəcanlarını şeir şəklində ifadə edən ədəbi əsər növlərindən biri. *Məhəbbət lirikası*. *Azərbaycan klassik lirikası. – İntim lirika yenə qüvvətli vətənpərvərlik motivlərilə çarpazlaşır.* M.Hüseyn. *Sən yenə sevgi lirikası ilə maraqlanırsan?* İ.Əfəndiyev. // Bu qəbildən olan əsərlər. *Füzulinin lirikası. Zakirin lirikası. S.Vurğunun lirikası.* // Hər hansı bir yazıçının əsərlərində, yaradıcılığında hiss və həyəcan ünsürləri; emosionallıq.

2. *məc.* Lirik əhval-ruhiyyə, təəssürat, daxili həyəcan; lirizm. *Əsərdə həzin bir kədər, incə və insanın qəlbini riqqətə gətirən bir lirika da vardır.* M.İbrahimov.

**LİRİK-DRAMATİK** [*yun.*] Lirika və drama ünsürlərini özündə birləşdirən, əks etdirən (ədəbi əsər haqqında). *Lirik-dramatik əsər*. // Musiqidə: lirik səslə dramatik səs arasında keçid təşkil edən (xanəndənin səsi haqqında). *Lirik-dramatik tenor*.

**LİRİK-EPİK** [*yun.*] Lirika və epos ünsürlərini özündə birləşdirən, əks etdirən (ədəbi əsər haqqında). *Lirik-epik poema*.

**LİRİZM** [*yun.*] 1. İncəsənət əsərində emosionallıq, bədii həyəcan, səmimi duyğu ünsürləri. *Üzeyir bəy musiqisinin lirizmi. – Səməd Vurğun poeziyasında Nizami müdrikliyi, Füzuli lirizmi, Vaqif sadəliyi, Sabir kəskinliyi vardır.* M.Arif.

2. Lirik əhval-ruhiyyə. *Lirizmə qapılmaq*.

**LİSAN** *is.* [*ər.*] *klas*. Dil. *Ey oğul, hər lisanə ol raqib; Xassə, ol rus elminə talib*. S.Ə.Şirvani. *O, eyni zamanda azad müdavim sifəti ilə darülfünunun şərq fakültəsinə davam edərək, lisan və ədəbiyyat problemlərilə məşğul olur.* Ə.Haqverdiyev. *A.Şaiq realni məktəbin türk lisanı müəllimi idi*. T.Ş.Simurq.

**LİSANÇI** *is. köhn.* Dilçi.

**LİSANİYYAT** *is.* [*ər.*] *köhn*. Dilçilik, dilşünaslıq, dil elmi.

**LİSÉNZİYA** *is.* [*lat.*] Mal aparmaq, mal gətirmək, çeşidli işlərlə məşğul olmaq üçün verilən rəsmi icazə sənədi.

**LİSÉY** [*yun*. Lykeion – Afinanın yaxınlığında Likeyli Apollon məbədinin bağçasındakı məktəbin adından] 1. 1917-ci il inqilabından qabaq Rusiyada: zadəgan oğlanları üçün imtiyazlı qapalı orta və ya ali məktəb.

2. Orta məktəb.

**Lİ́TER** [*lat.* lit(t)era – hərf] 1. Dəmir yolu və bəzi başqa nəqliyyat vasitələrində pulsuz

və ya güzəştlə getmək üçün (müəyyən hərflə işarə olunmuş) sənəd.

2. *mətb*. Tökmə hərf.

**LİTERLİ** *sif.* Literi olan, hərflə işarə edilmiş. *Literli loja* (rəqəmlə deyil, hərflə işarə olunmuş loja).

**LİTOQRAF** [*yun.*] Litoqrafiya mütəxəssisi, ustası.

**LİTOQRAFÇI** b a x **litoqraf**.

**LİTOQRAFİYA** [*yun*. lithos – daş və grapho – yazıram] 1. Litoqrafiya daşında şəkil çəkmə; üzərində şəkil çəkilmiş yastı daşdan çapetmə üsulu; daş basması. ◻ **Litoqrafiya daşı** – 1) litoqrafiyada çap işində istifadə edilən əhəngdaşlarından biri; 2) üzərinə şəkil çəkilmiş həmin daş.

2. Bu üsulla çap olunmuş şəkil və ya başqa şey. *Bədii litoqrafiya*.

3. Bu üsulla çap edən sex və ya müəssisə. *Litoqrafiyada işləmək. Litoqrafiyada çap edilmək. Rəngli plakat litoqrafiyada çap olunur.*

**LİTOLÓGİYA** *is.* [*yun.*] Çökmə süxurların tərkibi, quruluşu və mənşəyi haqqında elm.

**LİTR** [*fr*. litre] 1000 kub santimetrə bərabər maye ölçüsü. *Bir litr süd.*

**LİTRAJ** [*fr*. litrage] Hər hansı bir qabın litrlə tutumu. *Bakın litrajı.*

**LİTRLİK** *is. dan*. Bir litr tutan qab. // *sif.* Bir litr tutan. *Ağzı tıxaclı litrlik şüşəni pəncərə qabağına qoydu*. Mir Cəlal.

**LİTURGİYA** *is.* [*yun.*] Qədim Yunanıstan polislərində dövlət mükəlləfiyyəti.

**LİTVACA** *sif.* və *zərf* Litva dilində. *Litvaca qəzet. Litvaca danışmaq*.

**LİTVALI** *is.* Litvanın əsas əhalisini təşkil edən xalq və bu xalqa mənsub adam.

**LİVER** *is.* [*ing.*] Ətlik malın, qoyunun yeməli içalatı.

**LOBBİ** *is.* [*ing.*] Qanunverici hakimiyyətin üzvlərinə pərdəarxası təsir göstərən bankirlər, monopolistlər qrupu.

**LOBYA** *is. bot*. Paxlalılar fəsiləsindən birillik bostan bitkisi. *O tərəfdə də hörmə çəpərin içində sarmaşıqlar, göy lobyalar, günəbaxanlar, sarısaçaqlı qarğıdalılar bir-birinə qarışırdı*. S.Rəhimov. ..*Arvad-uşaq kiçik bostan salıb şaxa çıxan lobya, soğan əkirdilər*. Ə.Əbülhəsən. // Həmin bitkinin xörəkdə işlədilən toxumu. *İri lobya*. *Aş lobyası. Xəmiraşıya lobya tökmək.*

**LOBYAÇİLOV** *is.* Lobya ilə bişirilmiş aş; lobyalı çilov.

**LOBYALI** *sif.* Lobya qatılmış, lobya ilə bişirilmiş. *Lobyalı aş. Lobyalı xəmiraşı*.

**LOBYALIQ** *is.* Lobya əkilmiş yer, lobya bostanı. *Lobyalığı sulamaq. Lobyalığı alaq etmək.*

**LODKÁ** [*rus*. лодка] Qayıq. ..*Geniş və uzun hovuzda səyahət üçün kiçik lodkalar üzürdü*. M.S.Ordubadi. *Dəniz üzərində burada-orada bir çox yelkənli və yelkənsiz lodkalar görünürdü*. T.Ş.Simurq.

**LODKADABAN** *dan*. b a x **dikdaban**.

**LOĞAZ** *is.* [*ər.*] 1. İstehza, rişxənd, masqara, ələ salma. ◻ **Loğaz qoşmaq (oxumaq)** – 1) rişxənd etmək, istehzalı sözlər demək, lağa (araya) qoymaq. [Nəcəfalı:] *Keçmə bu aran tayfasının loğaz qoşmağından*. B.Bayramov; 2) ağzına gələni danışmaq, boş-boş danışmaq. **Loğaza qoymaq** – ələ salmaq, lağa qoymaq. **Loğaza qoyulmaq** – ələ salınmaq, masqaraya qoyulmaq. *Moldayı, salmadı el dil boğaza; Eybi yox, gərçi qoyulduq loğaza.* M.Ə.Sabir.

2. Uydurma, yalan; laf. [Zaman:] *İndi odur qudurublar, hərəsinin ağzından bir loğaz çıxır!* Ə.Haqverdiyev.

**LOĞMA** *is.* [*ər.*] 1. Bir dəfədə ağıza qoyulan çörək parçası; tikə, dişləm. *Loğma ki var, boğmadır*. (Ata. sözü). *O, çörək quru olduğundan hər loğma çörəyi bir qurtum su ilə ağzında isladıb yeyirdi*. A.Şaiq.

2. Ümumiyyətlə, çörək mənasında. *Yemə namərd loğmasın, Seyyid! Sifəti etməsin sənə təsir.* S.Ə.Şirvani. *Ey vay, bu fələk qoydu bizi loğmaya həsrət; Qaldıq biz adamsız*. M.Ə.Sabir. [Qədir:] *Çörək, yalnız bir loğma çörək üçün ailəmdən və əziz körpəmdən ayrılıram.* Mir Cəlal.

**LOĞMALAMA** "Loğmalamaq"dan *f.is.*

**LOĞMALAMAQ** *f. dan. kob*. Çörək (loğma) vermək; yedirmək.

**LOĞMALANMA** "Loğmalanmaq"dan *f.is.*

**LOĞMALANMAQ** *qayıd. dan. kob*. Çörək, loğma yemək; tıxmaq.

**LOĞMALIQ** *is.* 1. Adətən "bir" sayı ilə işlənərək bir dəfə ağza salmağa kifayət edəcək miqdarı bildirir. *Bir loğmalıq çörək.*

2. *kob*. “Yemək, çörək” mənasında. *Loğmalıq eləmisən?*

**LOĞMAN** Əfsanəvi bir həkimin adı olub, klassik ədəbiyyatda və canlı dildə bütün dərdlərə çarə edən, adamlara yol göstərən bilici şəxs mənasında işlənmişdir. *Loğman da gəlsə dirilməz. – Bir İsa nəfəsli, Loğman dəvalı; Vaqifəm, sevmişəm bir şux dilbəri.* M.P.Vaqif. *Dərdindən xəstəyəm, çəkərəm ahı; Ölürəm, Loğmanım, getmə, amandı!* Aşıq Ələsgər. *Burda yoxsa həkim, dərman; Bu dağlarda mənəm Loğman*. M.Dilbazi.

**LOJA** [*fr.*] Tamaşa zalında bir neçə adamın oturması üçün ayrılmış xüsusi yer. *Sağ loja. Lojaya bilet almaq. – Teatrın hər tərəfindən projektorlar oturduğumuz lojalara doğru çevrildi.* C.Cabbarlı. *Teatrın .. salonu və lojaları ağzına qədər dolu idi*. M.İbrahimov. *Yaxın lojalardan birində oturmuş Şirin onun hər bir hərəkətini seyr edirdi.* İ.Əfəndiyev.

**LOKAL** *sif.* [*lat.*] Yerli əhəmiyyətli, müəyyən yerə mənsub olan. *Lokal məsələ.*

**LOKASİYA** *is.* [*lat.*] Radiodalğaların köməyi ilə cismin yerini tapma.

**LOKÁTOR** [*lat.*] Hər hansı bir cisimdən çıxan səs və ya radio dalğalarının köməyi ilə həmin cismin yerini müəyyənləşdirən cihaz.

**LOKÁUT** [*ing*. lock-out – üzünə qapı bağlamaq] Burjuaziyanın fəhlə sinfinə qarşı mübarizə üsullarından biri olaraq, müəssisələrin bağlanması və fəhlələrin kütləvi surətdə işdən çıxarılması.

**LOKAUTÇU** *is.* Lokaut elan edən, lokautdan istifadə edən kapitalist.

**LOKOMOBÍL** [*fr.*] Müxtəlif maşınları hərəkətə gətirən buxar mühərriki; bu cür mühərriki olan maşın.

**LOKOMOTÍV** [*fr.*] Rels üzərində işləyən və vaqonları, qatarları hərəkətə gətirən maşın (parovoz, teplovoz, elektrovoz və s.). *Lokomotiv sürmək. Lokomotivi təmir etmək. – ..Aslanın gur səsi onun qulaqları ucunda lokomotiv düdüyü kimi çınladı*. A.Şaiq.

**LOQARÍFM** [*yun.* logos – nisbət və arithmos – say, rəqəm] *riyaz.* Verilən bir ədədi almaq üçün kökün vurulacağı üst dərəcə. *Loqarifm cədvəli. – ..Özbaşına buraxılmış bir uşaq, hesabın dörd əməliyyatını nə qədər yaxşı bilsə də, cəbr loqarifma qanunlarını kəşf etmək dərəcəsinə heç bir zaman gəlib çıxa bilməz..* M.İbrahimov. □ **Loqarifm xətkeşi** – müxtəlif hesablamalar aparmaq üçün alət; hesab xətkeşi.

**LOQARİFMLƏMƏ** “Loqarifmləmək”dən *f.is.*

**LOQARİFMLƏMƏK** *f. riyaz*. Verilən ədədin loqarifmini almaq.

**LOQQULDAMA** “Loqquldamaq”dan *f.is.*

**LOQQULDAMAQ** b a x **loqquldamaq**.

**LOQQULTU** *is.* 1. Tökülən, axan, bərk qaynayan mayedən hasil olan səs.

2. B a x **lökkültü**.

**LOM** [*rus.*] b a x **ling**. *Kim isə zəncirləri lom ilə yerə atır.* M.İbrahimov. *Qoca dəmir loma söykəndi.* S.Rəhimov. *Bir anda hərə əlinə keçən külüng, bel və lom ilə evin divarına hücum çəkdi*. Ə.Əbülhəsən.

**LOMBA** *is.* Qəliz maye və ya sıyıq şeyin iri və dairəvi parçası; iri damcı, böyük damla. *Mürəkkəb lombası. – Molla uşağı arxası qatda uzadır yerə, bir lomba tüpürür üzünə.* “M.N.lətif.” [Yetər:] *Cəbi, vallah, sən axırı məni o yerə gətirəcəksən, saqqalına lomba ilə tüpürəcəyəm*. N.Vəzirov.

**lomba-lomba** *zərf* Lombalar şəklində, iri damlalarla. *Mürəkkəb lomba-lomba düşdü.* □ **Lomba-lomba (içəri) ötürmək** *kob*. – tez-tez və acgözlüklə, iri tikələrlə yemək.

**LOMBALAMA** “Lombalamaq”dan *f.is.*

**LOMBALAMAQ** *f. dan. kob*. Lomba ilə yemək. [Mahmud:] *Bir tikə nədir, ay axmaq? Bütövünü götürüb lombalaya bilmirsən?* Ə.Haqverdiyev.

**LOMBÁRD** *is.* [*ital. coğr.* addan] Daşınar əmlakı və ya başqa bir şeyi girov kimi qəbul edib, borc pul verən kredit müəssisəsi. *Lombarda şey qoymaq*. – [Dürrə] *..evdən çıxıb şəhər lombardına yönəldi*. S.Vəliyev.

**LOPA**[1] *is.* 1. Odunu alovlandırmaq və ya işıq yaratmaq üçün neft hopdurulub yumruladılmış əski, cındır, pilik, alışqan. *Lopa qayırmaq*.

2. Az-çox yuvarlaq, yumru, dairəvi (şəkildə) olan yumşaq şey. *Qar lopası. Pambıq lopası*. – [Budur], *yenə məktəblərdən azad olub uşaqlar; Qarı görəcək sevinərlər, qar lopası oynarlar*. A.Səhhət. *Kəhər yerindən dördnala sıçrayıb, dırnağının altından palçıq lopaları səpələyə-səpələyə cumdu.* M.İbra-

himov. *Ay doğdu, sakitləşən havada oynaşan qar lopaları gümüşü rəng aldı.* B.Bayramov.

3. Qalın, yekə (bığ haqqında). *Lopa bığ. – Mürşüdoğlu özü bilmədən əlini lopa bığlarında gəzdirdi.* S.Rəhimov. *O, çəp gözünü qıyır, lopa bığlarının ucunu ağzına salıb gəmirir.* Ə.Vəliyev.

4. Qədimdə məşəl kimi yandırılan ucu xüsusi olaraq döyülüb lifləndirilmiş ağac şivi. [Ev sahibi] *burada cavan şiv zirinc ağacından qırıb gətirər, ocaqda ütüb çəkiclə döyər, özü üçün lopa düzəldərdi.* S.Rəhimov.

**lopa-lopa** *zərf* Lopalar şəklində; topa-topa, parça-parça. *Çöldə lopa-lopa qar yağırdı*. Çəmənzəminli. *Qar yağır lopa-lopa; Pəncərədən baxıram*. R.Rza. *Göydə lopa-lopa ağ bulud parçaları üzür*. Ə.Əbülhəsən.

**LOPA**[2] *is. məh*. Sabun bişirilərkən çıxan tullantı.

**LOPABIĞ(LI)** *sif.* Bığı lopa, qalın olan; yekəbığ(lı), yoğunbığ(lı). *Pəncərənin içində lopabığlı, uzun xəncərli, yan qoyulmuş yekə papaqlı bir kişi oturub, çubuq çəkirdi.* Çəmənzəminli. // İs. mənasında. [Abbasəli:] *Şəkil mənə yox, sənin kimi lopabığa oxşayır*. Ə.Abasov.

**LOPAGÖDƏN(Lİ)** *sif. dan*. Yumru, iri qarnı olan; yekəqarın. *Lopagödən kişi*.

**LOPAGÖDƏNLİK** *is. dan*. Lopagödən adamın xüsusiyyəti; yekəqarınlıq.

**LOPARLAR** *cəm* Saamların keçmiş adı.

**LOPUQ** *is.* Əyləncə üçün köpürülmüş ordlara yavaşca yumruqla, ya barmaqlarla vuraraq səs çıxartma. [Səlim bəy Nəcəf bəyə:] *Həmişə qış uzunu bikar qalanda oğlunla lopuqdan qumar oynayırdın*. Ə.Haqverdiyev. [Səriyyə:] *Ancaq şərtimiz budur ki, kim birinci çıxsa, dalda qalanların hərəsinə on beş lopuq vuracaq*. İ.Əfəndiyev.

**LOR** *is.* Pendir tutulan zaman onun suyunu qaynadıb süzməklə hazırlanan ağartı.

**LORD** [*ing.* lord] İngiltərədə nəslən keçən yüksək zadəgan titulu və bu titulu daşıyan şəxs. □ **Lordlar palatası** – İngiltərə parlamentinin yuxarı palatası. // Bəzən yüksək vəzifələrlə bağlı olan titul (məs.: lord-kansler, lord-mer).

**LORDLUQ** *is.* Lord titulu.

**LORNET** *is.* [*fr.*] Dəstəli qatlama eynək.

**LORT** *sif.* Şişman, sallaqqarın.

**LORTÇU** *is. məh.* Avara gəzib bir işlə məşğul olmayan adam. [Əhməd:] *..Nə söyləyirsən, bir lortçudur ki, bərabəri yoxdur, indi gələr, görərsən.* N.Vəzirov.

**LORTGÖDƏN(Lİ)** b a x **lortqarın(lı)**.

**LORTQARIN(LI)** *sif. məh.* Qazandığını qarnına xərcləyən, qarnına həddindən artıq qulluq edən; yeyimcil, qarınqulu. *O, bir lortqarındır ki, özü kimisi yoxdur.* S.Rəhimov.

**LORTLUQ** *is.* Şişmanlıq, qarnı yekəlik, qarnı sallaqlıq. *Çox kök, ağırlaşmış buğalarda tənbəllik və lortluq baş verir.* A.Ağabəyli.

**LORU**[1] *sif.* Ən adi, ən bəsit, ən sadə (dil, danışıq, söz haqqında). *Loru söz. Loru dildə danışmaq*. – [Bəbir bəy:] *Hürriyyətlik dediyin nədi? Özümüzük, lap loru deyək: özümüzük.* Mir Cəlal.

**LORU**[2] *is. dan*. Atın belinə yəhərin və ya çulun altına qoyulan qalın keçə; tərlik.

**LORULUQ** *is.* Sadəlik, bəsitlik (dil, danışıq, söz və s. haqqında).

**LÓSMAN** [*holl.* loodsman] *dəniz*. Yerli üzüş şəraitini, yerli su yollarını yaxşı bilən və gəmiləri həmin yerlərdən keçirməyi yaxşı bacaran gəmi işçisi. *Çay losmanı. Liman losmanı. – Məsləhətdir ki, bu şairliyini tərk edəsən; Təzə muzdur olasan kəştiyə, losmana, Yusif!* S.Ə.Şirvani. *Dəniz durğun, hava saf olduğu zaman qoca losmanlar keçərkən* [qalanı] *görür.* A.Şaiq. *Sevinclə işə gəlir losmanlar – Süveyş əhli.* O.Sarıvəlli.

**LOSMANLIQ** *is.* Losmanın işi, peşəsi, vəzifəsi. *Gəmidə losmanlıq etmək.*

**LÓSYON** *is.* [*fr.*] Dəri üçün qidalı kosmetik maye.

**LOŞ**[1] *sif.* və *zərf məh*. 1. Süst, ölgün. *Loş at. – Bəylər öküz kimi yatmışdı sərxoş; Paltarilə yerə sərilmişdi loş.* M.Müşfiq.

2. Boş, yerində və qaydasında bağlanmamış. *Atın beli loş bağlanmışdır. İpi loş sarımaq*.

**LOŞ**[2] *is. zool*. Hindxoruzu. *Avropa ölkələrində saxlanılan loşların hamısı gətirilmə cinslərdən törəmişdir.*

**LOTÓ** [*fr.*] Üstündə nömrələr (ya şəkillər) olan xüsusi kartlarda oynanılan bir oyun (bu oyunun xüsusiyyəti ondan ibarətdir ki, rəqəmlərin, ya şəkillərin tam sırasını kim tez örtərsə, o, oyunu udur). *Loto oynamaq. Lotoda udmaq.* // Bu oyuna lazım olan xüsusi

nömrələnmiş kartlar və daşlar. *Mağazadan loto almaq. Loto qutusu.*

**LOTOS** *is.* [*yun.*] Gözəl iri gülləri olan su bitkisi.

**LOTU** *sif.* və *is.* [*ər.* dini əfsanəyə görə, öz əxlaq pozğunluğu və rəzalətlərinə görə, guya Allahın qəzəbinə keçərək məhv olmuş Lut adlı bir qövmün adından] 1. Fırıldaqla, kələklə, əyri yollarla baş girləyən adam; kələkbaz, hərif. *Lotu dinməz-söyləməz .. gecəyarısı xəlvət gəzən iranlı məşədiləri kimi minbərdən züvüldəyib düşür yerə.* C.Məmmədquluzadə. *Bu qədər şeylər mənim, sən de, nəyin var, ay lotu?* Ə.Nəzmi. [Əliqulu:] *..Mənə Tehran lotusu Səfdər deyərlər.* S.S.Axundov. // Qeyri-ciddi adam, fırıldaqçı, cüvəllağı, tülüngü. *Lotunun biridir.*

2. Kefcil, hal əhli, əhli-kef. *Görükür ki, qazı lotudu və yaxşı adamdı.* C.Məmmədquluzadə. [Məşədi İbad:] *..İndi mən papağımı nə cür qoyum ki, qızın xoşuna gəlsin.. Hərgah belənçik qoysam, onda Şamaxı lotusuna oxşaram.* Ü.Hacıbəyov.

3. *dan.* Qeyri-qanuni ər; aşna.

**LOTU-BAMBILI** *sif.* və *is. dan.* b a x **lotu** 1-ci mənada. [Hacı Novruz:] *Yox, elə deyil. Başımızın çarəsi Mirzə Həsən kimi lotubambılıları, ac-gicikləri aradan götürməkdir.* Ə.Haqverdiyev. [Camal bəy:] *Quldur mən deyiləm, Sərdarovdur öz dostları ilə... Biri şərir İsmayıl bəy, piyaniska İbrahim bəy, biri lotu-bambılı Soltan bəy və qeyriləri...* N.Vəzirov.

**LOTUBAŞI** *is. dan.* Lotulara başçılıq edən adam (b a x **lotu** 1-ci mənada). *Bir gün lotubaşı dedi ki, gəlin gedək, padşahın xəzinəsini kəsək.* "Aşıq Qərib".

**LOTUBAZLIQ** *is. dan.* 1. Fəhşiyyat, lotuluq, alçaq işlər, pis-pis işlər; əxlaq pozğunluğu. *Lotubazlıqlara və arvadbazlıqlara rövnəq verən siğəbazlıq məsələsidir.* C.Məmmədquluzadə.

2. İşləməyib fırıldaqla, kələklə gün keçirmə. *Lotubazlıq eləmək.*

**LOTUBEÇƏ** *is. dan. zar.* Diribaş, zirək oğlan. // Kələkbaz, fırıldaqçı. *Bilmirəm ki, bu hesablar necədir; Adamları tamam lotubeçədir.* "Aşıq Qərib".

**LOTUXANA** *is.* 1. Əyyaş, pozğun, avara adamların toplaşdığı yer. *Avropada hansı bir şəhər var ki, orada Əbdülhəmidin hərəmxanasına oxşayan bir lotuxana olmasın?!* C.Məmmədquluzadə.

2. *dan.* Zarafatcıl, kefcil, deyib-gülən adamlar məclisi.

**LOTU-LOTUYANA** *zərf dan.* Açıq, səmimi olaraq. *Dəxi burada qəbz nəyə lazımdır, mən ölüm, lotu-lotuyana deyiniz görüm, burada qəbzin nə mənası var?* C.Məmmədquluzadə. [Cəbi:] *Yetər, .. lotu-lotuyana, gəlsənə mən arvadımı boşayım, mənə gələsən.* N.Vəzirov.

**LOTULUQ** *is. dan.* Kələkbazlıq, fırıldaqçılıq, biclik, hiyləbazlıq. *..Amma indiyədək bizi qoymuyublar bir dərvişin hoqqabazlığını tənqid edək, bir mərsiyəxanın lotuluğunu tənqid edək.* C.Məmmədquluzadə. [Rəsul:] *Hər kəs bir lotuluqla çıxır meydana, camaatın qulağını kəsir.* Ə.Haqverdiyev. ☐ **Lotuluq eləmək** – aldatmaq, kələk gəlmək, biclik eləmək, hiyləbazlıq etmək; // zarafat etmək, kələkbazlıq etmək. [Rüstəm bəy:] [Cavan oğlan] *qızın öz dayısıdır. Səninlə lotuluq eləyibdir, sən də inanırsan.* Ü.Hacıbəyov. **Özünü lotuluğa qoymaq** – özünü xəbərsiz kimi, bilməyən kimi göstərmək, lotuluq eləmək. [Molla:] *Guya ki, bilmirsən nə olub?.. Özünü lotuluğa qoyma?* "M.N.lətif."

**LOTU-POTU** *top. dan. nifr.* İşsiz-peşəsiz adamlar, avaralar; günlərini fırıldaqla, kələkbazlıqla keçirən adamlar, dələduzlar, lotular. [Aslan bəy:] [Süleyman bəy] *burada lotupotu ilə gəzib qumar oynayır.* Ə.Haqverdiyev. [Hacı Fərəc:] *..O dövlətə görə Ziynət xanıma hər tərəfdən müştərilər çıxacaq – lotu-potu, atasından bixəbər adamlar..* N.Vəzirov. [Hacı Murad:] *De görüm .. hansı tatın kitabındadır ki, .. pul qazanasan, verəsən toyuqplova, onu da gəlib-gedən, lotu-potu yesin.* S.S.Axundov.

**LOV** *is. dan.* Bəla, afət (adətən mənfi mənada çox zirək, diribaş adam haqqında). *Belə od olmaz, anam, böylə alov! Od deyil, yanğı deyil, lovdur, lov!* M.Ə.Sabir. *Burdan vurub Bitdilidən çıxar, .. lovdur lov!* Ə.Əbülhəsən.

◊ **Lov düşmək** – 1) çaxnaşma düşmək, həyəcan qalxmaq, bir-birinə dəymək; 2) cəncələ düşmək, qovğaya düşmək, gözlənmədən başına bir iş gəlmək. **Lov salmaq** – həyəcana salmaq, təşviş doğurmaq, çaxnaşma salmaq. *Qəsəbəyə dəxli olmayan bu xəbər*

*arvadların içinə lov salmışdı*. Ə.Əbülhəsən. **Lova düşmək** – əl-ayağa düşmək, çaxnaşmaya düşmək.

**LOVĞA** *sif.* Özü haqqında böyük fikirdə olan, başqalarına xor baxan; təkəbbürlü, təşəxxüslü. *Lovğa adam.* – [Gülpəri:] *Başına dönüm, qəssab Nəbinin övrəti bir lovğa şeydir*. Ə.Haqverdiyev. *Faşizmin gözünə sancıldı bir ox; Sarsıtdı zərbəniz lovğa düşməni.* R.Rza. // Özünü öyən, tərifləyən; gopçu. // İs. mənasında. *Lovğanın biridir*.

**lovğa-lovğa** *zərf* Təkəbbürlə, təşəxxüslə, dikbaşlıqla. *Lovğa-lovğa gülmək.* – [Koroğlu dedi:] *Lovğa-lovğa baxma mənə; Sar qonmaz yasəmənə.* "Koroğlu". [Oğlan uşağı] *Hidayətə baxıb dilini çıxartdı, .. qızın əlindən bərk yapışıb lovğa-lovğa aralandı.* B.Bayramov. // Özünü öyərək. *Lovğa-lovğa danışmaq*.

**LOVĞALANMA** "Lovğalanmaq"dan *f.is.*

**LOVĞALANMAQ** *is.* Özünü tərifləmək, özünü öymək, əsassız olaraq öz üstünlüyünü göstərməyə çalışmaq. *Cəfər gümanının doğruluğunu duyub lovğalandı*. Çəmənzəminli. *Dövlətli qadınlar toya və hamama ümumiyyətlə özlərini göstərməyə, varlı olmayanlar qarşısında lovğalanmağa gedirdilər*. H.Sarabski.

**LOVĞALAŞMA** "Lovğalaşmaq"dan *f.is.*

**LOVĞALAŞMAQ** *f.* Lovğa olmaq; lovğalanmaq. *Lovğalaşıb, a görməmiş, çox da belə fırıldama! Tərbiyəsiz uşaq kimi boş-boşuna hırıldama!* M.Ə.Sabir.

**LOVĞALIQ** *is.* Özünü çəkmə, təşəxxüs satma, iddia satma; təşəxxüs, təkəbbür, özünü tərif etmə, özünü öymə. [Ağ zanbaq:] *Gərçi uzundursa mənim yarpağım; Yoxdu yenə lovğalığım, azmağım*. A.Səhhət. ☐ **Lovğalıq etmək** – özünü öymək, tərifləmək, gop basmaq. [Zalxa:] *A kişi, sən onun sözünə nə inanırsan? Tamam o lovğalıq edir.* M.F.Axundzadə.

**LOVLU** *sif.* və *zərf* Dərdli, bəlalı. [Şahsənəm:] *Otağından durdun, gəldin yanıma; Qarı, mən lovlunu nə dindirirsən?* Xəstə Qasım. // *Həyəcanlı, təlaşlı. Lovlu danışmaq. Lovlu içəri girmək.* // b a x **başılovlu**.

**LOYÁL** [*ing.* loyal – sadiq] 1. Dövlət hakimiyyəti qanunlarına, qərarlarına (bəzən yalnız zahiri, rəsmi olaraq) sədaqət göstərən, qanun daxilində hərəkət edən. *Loyal adam. Loyal münasibət.*

2. Bir şeyə bitərəfcəsinə münasibət göstərən.

**LOYALLIQ** *is.* Loyal münasibət.

**LÖHRƏM** b a x **yort**. [Müəllim:] *..Bu gün onu boynuna alıb dəvə kimi löhrəm* (z.) *gedirsənsə, böyüyəndə onun qabağında durmaq olmaz.* Ə.Vəliyev.

**LÖHRƏN** *sif. məh*. Qüvvətli, münbit, məhsuldar. *Löhrən torpaq.*

**LÖK**[1] *is. köhn.* Dəvə balası. *Nökərin yekə dərdi; Yüklənib lökə dərdi; Nər olsa çəkə bilməz; Fil gərək çəkə dərdi.* (Bayatı).

**LÖK**[2] *is. məh.* Hündür ağacların başından, nazik budaqlardan meyvəni qırıb qoparmaq üçün başıəyri, nazik, uzun ağac; qarmaq.

**LÖKDODAQ(LI)** *sif.* Dodaqları qalın və sallaq olan; sallaqdodaq.

**LÖKDODAQLIQ** *is.* Dodaqların qalın və sallaq olma halı; sallaqdodaqlıq, qalındodaqlıq.

**LÖKKÜLDƏMƏ** "Lökküldəmək"dən *f.is.*

**LÖKKÜLDƏMƏK** *f.* Sanki nəbz kimi vuraraq, ara vermədən bir qaydada ağrımaq, sızıldamaq (çirk eləyən yara, çiban haqqında). *Dişim lökküldəyir. Çibanı lökküldəmək. – Milyonyarımlıq qüdrət ayaq dirəmiş yerə; Beton sütunlar ara lökküldəyən Xəzərə.* X.Rza.

**LÖKKÜLTÜ** *is.* Lökküldəmə. *Yaranın lökkültüsü. Dişin lökkültüsü*.

**LÖKLƏMƏ** 1. "Lökləmək"dən *f.is.*

2. Dəvə yerişini xatırladan yeriş tərzi.

**LÖKLƏMƏK** *f.* İri addımlarla, ağır-ağır yerimək (dəvə haqqında). *Dəvə, maya, nər, köşək; Lökləyirlər dalbadal*. A.Səhhət. *Lökləyib gedirdi ağır dəvələr*. M.Rahim.

**LÖKÜ** *is. məh*. Düyü unundan bişirilən qoğal.

**LÖKÜT** *is.* Qovurğa ilə süddən bişirilmiş xörək.

**LÖ-LÖ** *zərf dan*. Bekara, işsiz, avara, avara-avara. *Lö-lö gəzmək. Küçələrdə lö-lö vurmaq.*

**LÖVBƏR** *is. dəniz.* Gəmini və üzücü mayakları yerində saxlamaq üçün suya buraxılan zəncirə bağlanmış qarmaqlı metal ox. *Nəhəng burnunu sahilə dayayıb lövbər atmış balıqçı gəmisindən Tahirin hər zaman eşitdiyi mahnı səsləri ucalırdı*. M.Hüseyn. *On dörd dənizdə lövbər salır bizim gəmilər; On dörd dənizdən əsən küləklə yırğalanır.* Ə.Cəmil.

◊ **Lövbər(ini) salmaq (atmaq)** – məskən salmaq, bir yerdə oturub qalmaq, bənd olmaq. [Molla Hüsü Sərdara:] *Harda ki lövbər salıb oturublar, idarə düzəldiblər, ora da vurmaq lazımdır*. M.İbrahimov. **Lövbərini qaldırmaq** *zar.* – oturduğu yerdən çox çətinliklə, istəməyə-istəməyə, ağır-ağır qalxmaq. *Lövbərini qaldır, gedək.*

**LÖVBƏRLİ** *sif.* Lövbəri olan.

**LÖVBƏROTU** *bot.* bax **dəmirtikan** 1-ci mənada.

**LÖVHƏ** *is.* [*ər.*] 1. Üzəri tabaşirlə yazıla bilən qara rəngli taxta; yazı taxtası. *Sinfə lövhə asmaq. Lövhədə yazmaq.* – [Aslan] *tabaşiri götürüb lövhəyə cumur, tez-tez yazır-tökür, lövhə rəqəmlərlə dolur və ağarırdı.* S.Rəhimov. □ **Yazı (sinif) lövhəsi** – sinifdə tabaşirlə yazmaq üçün qara rəngli lövhə; yazı taxtası.

2. Müxtəlif məqsədlər üçün işlənən hamar səthli elastik metal və s. parçası. *Sink lövhəsi.*

3. Üstündə hər hansı bir müəssisənin, idarənin, təşkilatın adını, yaxud gördüyü işi bildirən yazı yazılmış taxta, metal və s. *Hər gün yüzlərlə adam tanımadığı idarə və müəssisəni, küçəni lövhələr vasitəsilə tanıyır.* // Bildiriş, elan taxtası. *Çox qapılarda "işçi lazım deyil" deyə lövhələr asılmışdı.* Çəmənzəminli. *Parklarda, yay meydançalarında və kinolarda göstəriləcək repertuarlar elan lövhələrində müxtəlif rəngli hərflərlə yazılmışdı.* S.Rəhimov. [Veys:] *..lövhələri, kağızları cırıb yerə tökməyə başladı*. Ə.Əbülhəsən.

4. Şəkil, mənzərə şəkli, rəssamlıq əsəri, tablo. *Kənd biçimli bir şəhərin; Lövhəsini çəkirəm mən*. S.Vurğun. *O biri otağa açılan hündür qapı üzərindən böyük bir lövhə asılmışdı*. M.Hüseyn. // Mənzərə, təsvir. *Kənd həyatında – təbiətin o zəngin və geniş qucağında nə qədər canlı lövhələr, unudulmaz xatirələr vardır!* A.Şaiq. *Süzdü rəssam ürəkaçan bu xoş lövhəni; Dedi: – Usta, halal olsun, cəld işləyirsən.* Ə.Cəmil.

◊ **Qırmızı lövhə** – bax **şərəf lövhəsi**. **Şərəf lövhəsi** – istehsalatda və s.-də işləri ilə fərqlənən ən yaxşı işçilərin adları və ya şəkilləri vurulan taxta. *Tikintinin şərəf lövhəsində onun adının yanında gündə qazıdığı torpağın rəqəmini yazırdılar*. Ə.Sadıq.

**LÖVHƏCİK** *is.* Balaca lövhə, kiçik lövhə.

**LÖVHƏLİ** *sif.* Lövhəsi (2-ci mənada) olan.

**LÖVHƏŞƏKİLLİ** *sif.* Lövhəyə oxşayan. *Aptek təcrübəsində silindr və lövhəşəkilli müəyyən diametrli ələklər işlədilir.* R.Əliyev.

**LÖVHƏYAZAN** *is.* Lövhə (1-ci mənada) yazmaqla məşğul olan şəxs.

**LÖYÜN** *is.* [*ər.*] *dan.* Görkəm, görünüş. *Löyünü yaxşıdır* (*pisdir*).

**LÖYÜNLÜ** *sif. dan*. Görkəmli, görünüşlü. *Pis löyünlü oğlan.*

**LÖYÜNSÜZ** *sif. dan.* Görkəmsiz, biçimsiz, görünüşü olmayan. *Qarşıya löyünsüz bir qız çıxdı.*

**LUİDOR** *is.* [*fr.*] Fransada qızıl sikkə (6-7 qramlıq təmiz qızıl).

**LUMU** *dan.* bax **limon**. *Qazı Məşədi ilə xudahafiz edib dedi: – Məşədi, lumu, mürəbbə, əlbəttə, yadından çıxmasın.* C.Məmmədquluzadə. *Rəşid müəllim lumusu əzilmiş stəkanının son qalığını da içib ayağa qalxdı.* S.Rəhimov.

**LUMULU** bax **limonlu**. *Hətta namaz vaxtı da mömin müsəlmanın fikri və zikri dolu olar iskəncəbi ilə, lumulu çay ilə.* C.Məmmədquluzadə. *Zəki .. özü şam edib lumulu çay içdi.* M.Süleymanov.

**LUNATİ́K** [*rus.*] Lunatizmi olan adam.

**LUNATİ́ZM** [*rus.*] Gecə yuxusu zamanı qeyri-şüuri halda gəzməkdən və başqa avtomatik hərəkətlər etməkdən ibarət xəstəlik halı.

**LUNOXOD** *is.* [*rus.*] Ay səthində tədqiqatlar aparmaq üçün xüsusi aparat.

**LUNOMOBİL** [*rus.*] Ayda avtomatik surətdə elmi tədqiqat işləri aparmaq və məlumatları Yerə vermək məqsədilə tarixdə ilk dəfə 1970-ci ildə Sovet İttifaqı tərəfindən raket vasitəsilə Ay səthinə endirilən özüyeriyən maşın. *Lunomobillə ikitərəfli rabitə yaradılmışdır*.

**LÚPA** [*fr.*] Çərçivəsi olan böyüdücü optik cihaz; zərrəbin. *İsa dayı lupanı Səməndərin üz-gözündə dolandırdı*. B.Bayramov.

**LÜĞAB** *is.* [*ər.*] Ağız suyu, tüpürcək, selik. *Azalmaqda olan ağız lüğabı qurumağa üz qoymuş*(*du*). Ə.Vəliyev.

**LÜĞABLI** *sif.* Lüğab qarışıq, içində lüğab olan; selikli.

**LÜĞƏT** *is.* [*ər.*] 1. Adətən əlifba sırası ilə düzülmüş, izahı və ya başqa dilə tərcüməsi verilmiş sözlər toplusundan ibarət kitab; sözlük. *İzahlı lüğət. Azərbaycanca-rusca lüğət. – Qalın lüğətləri araşdıraraq; Dərsə hazırlaşır məktəbli Xumar.* S.Vurğun. *Yunis dəftərlərini açıb bir-bir yazdığı və lüğətdən tapmadığı sözləri soruşdu.* Mir Cəlal.

2. Bax **leksika**.

**LÜĞƏTÇƏ** *is.* Kiçik lüğət, balaca lüğət. *Şagirdlər üçün lüğətçə tərtib etmək.*

**LÜĞƏTÇİ** *is.* Lüğət tərtib edən, lüğətçiliklə məşğul olan mütəxəssis; leksikoqraf.

**LÜĞƏTÇİLİK** *is.* Lüğət tərtibi işinin nəzəriyyə və praktikası; leksikoqrafiya.

**LÜĞƏTŞÜNAS** *is.* [*ər.* lüğət və *fars.* ...şünas] bax **leksikoloq**.

**LÜĞƏTŞÜNASLIQ** bax **leksikologiya**.

**LÜĞƏVİ** *sif.* [*ər.*] Lüğətə aid olan; leksik. *Sözün lüğəvi mənası* (sözün qrammatik mənadan fərqli olaraq adi mənası).

**LÜL**[1] *əd. dan.* Adətən "atəş", "qənbər", "kefli" sözlərinin qabağına gələrək sərxoşluğun, kefliliyin son həddini bildirir. [Rəşid:] *İndiyəcən kef üçün içirdim, heç ömrümdə piyan olmurdum, bu gün dərddən içmişəm, özüm də lül qənbərəm.* M.Hüseyn. [Zalxa:] *Bu, lül keflidir ki.* S.Rəhman.

**LÜL**[2] *sif. dan.* Başdan-başa, bütün, səlt. *Lül yağdır.*

**LÜLƏ** *is.* 1. Odlu silahların gülləyə, mərmiyə lazımi istiqamət verən boruşəkilli hissəsi. *Topun lüləsi. – Tüfəngin lüləsi hakimin böyrünə toxundu.* M.Hüseyn. *Karl .. avtomatın lüləsini yoxladı.* Ə.Əbülhəsən.

2. Boru (silindr) şəklində yuvarlanmış, lülələnmiş şey. *Kağız lüləsi. Bir lülə müşəmbə.* – [Xortdan:] *..cibindən bir lülə kağız çıxardıb başladı onu oxuduqca açmağa.* Ə.Haqverdiyev. *Taxtapuşun qıraqlarından və borularından buz lülələri sallanmış, hava isə gömgöy göyərmişdi.* S.Rəhimov. // Halqalar şəklində burulmuş şey. *Saç lüləsi. Lülə sap.*

3. *anat.* Qolda, qıçda: boru şəklində içiboş sümük. [Qəhrəman:] *Sağ qolumun lüləsini sındırmışdı.* H.Nəzərli.

4. Bax **lüləkabab**.

**lülə-lülə** *sif.* və *zərf* Lüləyə oxşar, lülə kimi, lülələr şəklində. *Lülə-lülə buz. – Ağaclardan buz sallanıb lülə-lülə.* R.Rza. *Ağacların budaqları lülə-lülə qara bükülmüş, axar sular donmuşdu.* M.Rzaquluzadə.

**LÜLƏKABAB** *is.* Döyülmüş ətdən bişirilən lülə şəklində kabab. *Qurban qoyunun ətindən qız evi oğlan evinə lüləkabab, girs və dolma göndərər..* R.Əfəndiyev. [Səfərəli:] *Qabaqcadan verrəm lüləkabab, ondan sonra plov.* N.Vəzirov.

**LÜLƏKABABLIQ** *is.* Lüləkabab üçün yarayan, lüləkabab üçün ayrılan. *Lüləkababhq ət.*

**LÜLƏLƏMƏ** "Lülələmək"dən *f.is.*

**LÜLƏLƏMƏK** *f.* Düz şeyi yuvarladaraq lülə şəklinə salmaq. *Kağızı lülələmək. Kilimi lülələmək. Müşəmbəni lülələmək.* // Eşmək. *O, körüyün yanından maxorka qutusunu götürdü, bir parça qəzet kağızını lülələyib, maxorkanı içinə doldurdu.* M.S.Ordubadi. [Mehrəli] *gözlüyün uclarını qulaqlarına keçirdi, sonra tütün qutusunu çıxardıb, iri bir papiros lülələdi..* Çəmənzəminli.

**LÜLƏLƏNMƏ** "Lülələnmək"dən *f.is.*

**LÜLƏLƏNMƏK** 1. *qayıd.* Lülə şəklinə düşmək, burulub lülə halına gəlmək, lülə olmaq. *Həmişəyev .. dərindən nəfəs alıb dikələn kimi layihə öz-özünə bükülüb lüləlendi..* B.Bayramov.

2. *məch.* Lülə şəklinə salınmaq, lülə halına gətirilmək. *Qarabağ vəziri .. irəli çıxdı, lülələnib şal qurşağına qoyulmuş tirmə kağızı açdı..* Çəmənzəminli.

**LÜLƏLƏNMİŞ** *f.sif.* Lülə şəklinə salınmış. *Lülələnmiş xalça. Lülələnmiş kağız. – ..Üç nəfər memar köməkçiləri qoltuqlarında lülələnmiş kağız sarıqları içəri girdilər.* S.Rəhimov. *Vahid lülələnmiş cürbəcür kağızları bir-bir nəzərdən keçirib oturdu.* Mir Cəlal.

**LÜLƏLİK** bax **lüləkabablıq**.

**LÜLƏMAYA** *is. məh.* 1. Körpə uşağın başında bərkiməyib yumşaq qalan yer; əmgək.

2. Qabığı bərkiməmiş yumurta. // Ümumiyyətlə, bərkiməyib yumşaq qalan şey. *Lüləmaya xəmir.*

**LÜLƏYİN** *is.* [*ər.*] Misdən, saxsıdan, plastik kütlədən və s.-dən qayrılan xüsusi biçimli lüləkli və qulplu suqabı. [Molla Salman:] *Hacı Nuru, sənin qiyasına görə mən gərək Qarun olaydım, bəs mən niyə bir həsir və lüləyindən qeyri bir zada malik deyiləm.*

M.F.Axundzadə. *Yuxarı başda qoyulmuşdu bir bükülü yorğan-döşək, bucaqda var idi bir sənək, bir lüləyin və süpürgə.* C.Məmmədquluzadə.

**LÜLLƏNMƏ** "Lüllənmək"dən *f.is.*

**LÜLLƏNMƏK** *f. dan.* Bərk keflənmək.

**LÜMBÁQO** [*lat.*] *tib.* Əzələlərin, bəzən əsəblərin və fəqərə sümüklərinin xəstəliyi nəticəsində bel nahiyəsində ağrı, sancı, bel ağrısı (xəstəlik).

**LÜMƏ(K)** *sif.* Quyruğu olmayan və ya qısa olan; quyruğukəsik. *Lümə xoruz* (*toyuq*). – *Cücələrim lümək-lümək; Qanadları gödək-gödək.* A.Səhhət. *Kəkilli lümə toyuq sürüləri Gülşənin çox xoşladığı və həzz aldığı şeylərdən idi.* Ə.Vəliyev. // *zar.* Kəsilmiş, qısaldılmış, kəsik. *Lümək saç. Lümək paltar.*

**LÜMİNÁL** [*lat.* lumen – işıq] *əcz.* Acı dadan kristallik toz halında yuxu dərmanı.

**LÜMİNESSÉNSİYA** [*lat.* luminis – işıq] *fiz.* Cismin müxtəlif səbəblər üzündən (məs.: işıqlanması, içərisindən elektrik cərəyanı keçməsi, yaxud kimyəvi proseslər nəticəsində) soyuq şüalanma hadisəsi.

**LÜM-LÜM** *zərf məh.* Bütöv-bütöv, parça-parça. *Özü lüm-lüm udur batində, amma; Zahirdə dediyi mənaya bir bax.* Q.Zakir.

**LÜMLÜT** *sif.* Tamamilə lüt, soyunmuş, paltarsız, çılpaq, lüt-üryan.

**LÜMPEN-PROLETARİAT** [*alm.*] Kapitalizm cəmiyyətində: sinfi simasını itirmiş adamlardan ibarət təbəqə (səfillər, avaralar, dilənçilər, oğrular və s.).

**LÜSTR** [*fr.*, əsli *ital.*] bax **çilçıraq**. *Bir də görərdin lüstrü yandırıb, evi çıraqban elədi.* Mir Cəlal.

**LÜT** *sif.* 1. Paltarını tamam çıxarmış; çılpaq, üryan. *Lüt uşaq.* – *O halda ay çıxdı buludlar dalından; Gördü çöldə durmuş bir kişi lüt* (z.), *üryan.* A.Səhhət. *Zindanxanada dar ağacı quruldu. Zamanı lüt* (z.) *soyundurub dara çəkdilər.* Çəmənzəminli. ☐ **Lüt olmaq** – soyunmaq, bütün paltarını çıxarmaq.

2. *məc.* Ağacsız, bitkisiz, quru. *Lüt dağ. Lüt təpə. Lüt sahə.* – *Dağların hərəsi bir rəng çalır, çünki bunların eləsi var ki, meşələrlə örtülüblər, amma dağların əksəri lütdürlər.* C.Məmmədquluzadə. // Xəzan olmuş, yarpaqları tökülmüş. *Lüt ağac.* – *Ağacların çırpınan lüt budaqlarını qar tutub sakitləşdirmişdi.* B.Bayramov.

3. *məc.* Yoxsul, kasıb, heç bir şeyi olmayan. *Nəbinin ən yaxın dostu lüt Abış vəziyyətdən Nəbini xəbərdar edir.* "Qaçaq Nəbi". *Kim deyər ki, lüt bir rəncbərə iş kəsməkdə qəza məhkəməsi bu qədər götür-qoy eləməli olacaq!* Mir Cəlal. ☐ **Lüt qoymaq** – varyoxunu əlindən çıxartmaq; yoxsullaşdırmaq. *Bura niyə adamın üzünə gülsün, ora adamı soyundurub lüt qoysun?* S.Rəhimov. // İs. mənasında. *Lütün biridir.* – [Zeynəb Nadirə:] *Nə görmüsən bu çolaq Məcidin evində, acın, lütün yanında.* B.Talıblı.

**LÜT-ANADANGƏLMƏ** *sif.* və *zərf* Tamamilə lüt, lümlüt.

**LÜTCƏ** bax **lüt** 1-ci mənada. *Lütcə uşaq.*

**LÜTERAN** [*xüs. is.*-dən] 1. Lüteran dininə mənsub adam.

2. Bax **lüteranlıq**. *Lüteran kilsəsi.*

**LÜTERANLIQ** *is.* [*xüs. is.-dən*] XVI əsrdə reformasiya nəticəsində Almaniyada Martin Lüter tərəfindən əsası qoyulmuş xristian məzhəbi (protestantizmin bir növü, başlıca olaraq Almaniyada və Skandinaviya ölkələrində yayılmışdır).

**LÜT-ƏTCƏ** *sif. dan.* 1. Çılpaq, ətcə (uşaq haqqında). *Mənə elə gəlirdi ki,* [Azad] *ana bətnindən lüt-ətcə bu soyuq dünyaya qədəm qoyduğu zaman belə səsini çıxarmamışdır.* M.İbrahimov.

2. *məc.* Balaca, körpə. [Zeynal:] *Ey lüt-ətcə balalar! Başıma yığılın.* Ə.Əbülhəsən.

**LÜTF** *is.* [*ər.*] *klas.* İltifat, mərhəmət: mehribanlıq, yumşaqlıq; xoş, alicənab münasibət. *Vaqif haqdan dilər lütfü kərəmlər; Belə yerdə duran, vallah, vərəmlər.* M.P.Vaqif. [Pərviz xan:] *Mərhəmətiniz artıq, lütfünüz ziyad, sayəniz kəm olmasın.* M.S.Ordubadi. ☐ **Lütf etmək (qılmaq)** – 1) mərhəmət etmək, iltifat göstərmək, xeyirxahlıq etmək. *Bu sözə nisbət sənə gəl bir hekayət söyləyim; Lütf edib qıl bir nəzər, bu müxtəsər dəstanə bax.* M.V.Vidadi. *Çün yar qılıb lütfünü kəm, hanı o həmdəm; Ta sülh qıla yar ilə Heyran arasında.* Heyran xanım; 2) rəhm edib bağışlamaq, vermək. *Ol gün ki, sənə xaliq edər lütf bir övlad; Olsun ürəyin şad!* M.Ə.Sabir. // Köməklik, inayət, mərhəmət. [Hacı Qara:]

*Mən Allahın lütfü ilə yalnız onların iyirmisinin öhdəsindən gələrəm.* M.F.Axundzadə.

**LÜTFƏN** *zərf* [*ər.*] *kit.* "Lütf edin", "zəhmət olmasa", "zəhmət çəkin", "xahiş edirəm" mənasında nəzakətlə müraciət ifadə edir. *Lütfən oturunuz. Lütfən söyləyin.* – [Student:] *Bağışlayın, sizə zəhmət verirəm, otağın qiymətini lütfən söylərmisiniz?* Çəmənzəminli. [Firəngiz:] *Mən sizə göndərdiyim məktubların lütfən qaytarılmasını rica edərdim.* C.Cabbarlı. [Şeyx Sənan:] *Baba dərviş! Qılmayın lütfən; Bizi məhrum feyzi-söhbətdən.* H.Cavid.

**LÜTFKAR** *is.* [*ər.* lütf və *fars.* ...kar] Mərhəmətli, xeyirxah; adamlara iltifat göstərən, yaxşılıq edən. *Lütfkar adam. – Pəridən xoşliqa, qılmandan əla; Məlayikdən gördüm lütfkar səni.* "Lətif şah". *Mehriban, lütfkar, doğma bir səs də; Bəzən ordu kimi yol açır bizə.* S.Vurğun.

**LÜTFKARLIQ** *is.* Lütfkar olma, iltifat etmə, mərhəmət göstərmə; xeyirxahlıq, iltifatlılıq. *Lütfkarlıq göstərib, .. ayrıca otaq verən mehmanxana sahibəsi Nərgizin gözündə yüksəldi.* B.Bayramov.

**LÜTLƏMƏ** "Lütləmək"dən *f.is.*

**LÜTLƏMƏK** *f.* Tamamilə soyundurmaq, lüt etmək.

**LÜTLƏNMƏ** "Lütlənmək"dən *f.is.*

**LÜTLƏNMƏK** 1. *qayıd.* Paltarını soyunub lüt olmaq.

2. B a x **lütləşmək**. *Ağaclar getdikcə lütlənirdi.*

**LÜTLƏŞMƏ** "Lütləşmək"dən *f.is.*

**LÜTLƏŞMƏK** *f.* 1. Yarpaqları tökülmək, çılpaqlaşmaq (ağaclar haqqında). *Payız fəsli ağaclar lütləşir. – Mirzə Valeh bu pəncərədən payız xəzanının gəldiyini, yaşıl ağacların lütləşdiyini həmişə seyr edirdi.* S.Rəhimov. *Ağaclar lütləşmiş olsa da, həmişəcavanlar onu gizlədə bildilər.* B.Bayramov.

2. *məc.* Var-yoxu əlindən çıxmaq, kasıblaşmaq, yoxsullaşmaq.

**LÜTLÜK** *is.* 1. Çılpaqlıq.

2. *məc.* Bitkisizlik; yaşıllıqdan, bitkidən məhrumluq. *Yamacların lütlüyü.*

3. *məc.* Yoxsulluq, kasıblıq.

**LÜT-MADƏRZAD** *sif.* və *zərf* b a x **lümlüt**.

**LÜT-MÜT** *sif. dan.* 1. Tamamilə lüt, çılpaq, lüt-üryan.

2. *məc. top.* Yoxsul, kasıb, səfil. *Oxuyandan sonra bir qədər fikir edin. Ey mənim yolçu, dilənçi, lüt-müt qardaşlarım!* C.Məmmədquluzadə.

**LÜT-ÜRYAN** *sif.* 1. Lüt-anadangəlmə, lümlüt. *Məcidin göldə suyu şappıldada-şappıldada qol-qanad çalması, sonra da lüt-üryan* (z.) *çay qırağında oynaması Xırdanı lap darıxdırdı.* S.Rəhimov. ◻ **Lüt-üryan olmaq** – lüt-anadangəlmə olmaq, lümlüt olmaq. [Fatmanisə:] *Lüt-üryan olub kişilərin qabağına çıxdı.* M.İbrahimov.

2. *məc.* Yoxsul, kasıb. ◻ **Lüt-üryan qalmaq** – var-yoxu əlindən çıxmaq. *Yəqin evini yarıblar, var-yox əlindən gedib. Yaxşı lüt-üryan qaldı küçələrdə.* Mir Cəlal.

**LÜZUM** *is.* Lazım olma, işə yarama, lazımlıq. // Ehtiyac, hacət. ◻ **Lüzum görmək** – lazım bilmək, vacib hesab etmək. [Nizami:] *Bir həqiqəti təkrar etməyə lüzum görmürəm.* M.S.Ordubadi. **Lüzum yox(dur)** – ehtiyac yoxdur, lazım deyil. [Ədil bəy:] *İnanıram, əzizim, tarixə baxmağa lüzum yoxdur.* S.S.Axundov. [Vaqif İbrahim xana:] *Hələ ehtiyaca lüzum yoxdur.* Çəmənzəminli.

**LÜZUMİYYƏT** [*ər.*] b a x **lazımlıq**.

**LÜZUMSUZ** b a x **lazımsız**. [Gənc:] *Bu gün heç kəs yediyi və geydiyi şeylərdən başqa artıq, lüzumsuz şeyləri toplamır.* Çəmənzəminli. *Naşad əfəndi heç də mətləbə dəxli olmayan lüzumsuz sözlər ilə* [Mehribanın] *canını sıxırdı.* S.Hüseyn. *Gövhər xanım hər şeyi səliqəyə saldıqdan sonra oturdu və yenə də lüzumsuz şeylərdən söhbət etdi.* Q.İlkin. ◻ **Lüzumsuz bilmək (saymaq)** – lazım bilməmək, vacib hesab etməmək. [Bəhlul:] *Nicat dayının .. qızını mənə təklif eləməyini ona görə lüzumsuz sayırdım ki, xoşuma gəlmirdi.* B.Bayramov.

**LÜZUMSUZLUQ** b a x **lazımsızlıq**.

**LYA** [*ital.* la] Musiqi qammasının altıncı səsi, habelə bu səsi göstərən not.

**LYÜK** [*holl.*] Bir şeyin içərisinə girmək (düşüb-çıxmaq) üçün adətən qapağı olan dəlik və bu dəliyi örtən qapağın özü (məs.: tankda, gəmidə və s.-də).

# Mm

**M** Azərbaycan əlifbasının on doqquzuncu hərfi. B a x **em**.

**MAAF** *is.* [*ər.*] *köhn.* Hər cür vergi və mükəlləfiyyətdən azad olan kəndli.

**MAARİF** *is.* [*ər.*] Əhali arasında savad, bilik, mədəniyyət yaymaq üçün mütəşəkkil surətdə həyata keçirilən tədbirlər sistemi. *Xalq maarifi. Maarif xərcləri. Maarif şöbəsi.* // Əldə edilən bilik, təhsil, savad. *Maarifə meyil və həvəs. – Şərəflə ömrünü sərf et maarif uğrunda; Gözətlə izzəti-nəfsin, unutma vicdanın.* Ə.Vahid.

**MAARİFÇİ** *is.* 1. Xalq arasında maarifi, mədəniyyəti, bilikləri yayan, xalqı savadlaşdıran.

2. *tar.* XVII-XVIII əsrlərdə Qərbi Avropada və XVIII-XIX əsrlərdə Rusiyada maarifçilik cərəyanı nümayəndəsi. *Fransız maarifçiləri. Rus maarifçiləri.*

**MAARİFÇİLİK** *is.* 1. Maarifi yayma, maarif tərəfdarı olma; maarifpərvərlik. "*Bahadır və Sona*" *kimi lirik bir əsərdə də ədib öz maarifçilik fikirlərini davam etdirir.* M.Arif.

2. *tar.* XVII-XVIII əsrlərdə Qərbi Avropada və XVIII-XIX əsrlərdə Rusiyada feodalizmi tənqid edən və xalqın maariflənməsinə tərəfdar olan mütərəqqi ideya hərəkatı. *Maarifçilik ideyası.*

**MAARİFLƏNDİRİLMƏ** "Maarifləndirilmək"dən *f.is.*

**MAARİFLƏNDİRİLMƏK** *məch.* Təlim və təhsil nəticəsində elm, bilik verilmək; mədəniləşdirilmək, savadlandırılmaq.

**MAARİFLƏNDİRMƏ** "Maarifləndirmək"dən *f.is.*

**MAARİFLƏNDİRMƏK** *f.* Maarif, elm, bilik, mədəniyyət vermək; savadlaşdırmaq. *Xalqı maarifləndirmək.*

**MAARİFLƏNMƏ** "Maariflənmək"dən *f.is.*

**MAARİFLƏNMƏK** *qayıd.* Elmli olmaq, bilik qazanmaq, mədəniləşmək, savadlanmaq.

**MAARİFPƏRƏST** [*ər.* maarif və *fars.* ...pərəst] b a x **maarifçi** 1-ci mənada.

**MAARİFPƏRƏSTLİK** b a x **maarifçilik** 1-ci mənada.

**MAARİFPƏRVƏR** [*ər.* maarif və *fars.* ...pərvər] b a x **maarifçi** 1-ci mənada. *Söz yox, maarifpərvərlərimizdən çoxları tapıla bilər ki, bəzi qəzetləri əvvəlinci nömrəsindən ilin axırınadək yığıb kitab bağlayırlar.* C.Məmmədquluzadə. *Qəzetin naşiri Məmmədağa Şaxtaxtlı maarifpərvər, xeyirxah və mütərəqqi bir adam olmuş*(*dur*). M.İbrahimov.

**MAARİFPƏRVƏRLİK** b a x **maarifçilik** 1-ci mənada. *Heyf, səd heyf ki, ittifaqı pozan və ittihadın bünövrəsinə rəxnə yetirən əvvəlcə o kəslər oldu ki, maarifpərvərlik ismini üstlərinə götürüb rəyasətlik iddiasındadırlar.* F.Köçərli.

**MAAŞ** *is.* [*ər.*] Əmək, iş əvəzində alınan pul, haqq; aylıq, donluq, məvacib. *Maaş almaq. Maaş cədvəli.* – [Mirzə Səfərin] *iyirmi beş manat da maaşı vardı.* Ə.Haqverdiyev. *Biz sadəcə icraçıyıq; Maaş alıb iş görürük.* B.Vahabzadə.

**MAAŞLI** *sif.* 1. Maaş alan, maaşla olan; donluqlu, məvacibli. *Maaşlı iş.*

2. *məc.* Maaşı çox olan, yaxşı maaş verilən, əmək haqqı böyük olan. *Maaşlı vəzifə.*

**MABAQİ** *is.* [*ər.*] *köhn.* Bir məbləğin, bir hesabın qalığı, qalan hissəsi. [Əhməd:] *Axtar, gör bir üç manat tapa bilərsənmi? Mabaqisi sonra da çata bilər.* N.Vəzirov.

**MABEYN** *is.* [*ər.*] *köhn.* Ara, aralıq; orta, ortalıq. *..Məişət ilə məktəbin mabeynində əsla ittifaq və saziş yoxdur.* F.Köçərli. [Baqqal Məşədi Rəhim:] *Bax, Molla dayı, and verirəm səni mabeynimizdə olan sədaqətə, əgər evinizdə qənd var, xub olsun, əgər yoxdursa, beş-on girvənkə yarmarka qəndi apar.* C.Məmmədquluzadə.

**MABƏD** *is.* [*ər.*] *köhn.* Ard, dal, davam. *Bir gecəlik söhbətin min gecə mabədi var.* (Ata. sözü). [Mehdi bəy:] *Cümə axşamı bugünkü kefin mabədi bizdədir.* S.S.Axundov.

**MAC**[1] *is.* Kotan dəstəsi. *..Qara kəlim qarğıyar; Kotan macı tutana.* (Bayatı).

**MAC**[2] *is.* [*ər.*] *köhn.* Yarımay, hilal.

**MACAL** *is.* [*ər.*] İmkan, fürsət, vaxt. *Macalı olmamaq. Macal tapmaq. – Gərək elə eləyək ki,* [Koroğlu] *macal tapa bilməsin.* "Koroğlu". [Hacı Qara:] *Buların qumaşı özgə qumaşdır, müştəri macal vermir, göydə götürür.* M.F.Axundzadə.

**MACALSIZ** *sif.* Macalı olmayan, başı qarışıq, vaxtı, imkanı olmayan. *Macalsız adam.*

**MACALSIZLIQ** *is.* Macalı olmama, vaxtı olmama.

**MACARCA** *sif.* və *zərf* Macar dilində. *Macarca dərslik. Macarca danışmaq.*

**MACAR(LAR)** Macarıstanın əsas əhalisini təşkil edən və dil cəhətdən fin-uqor qrupuna daxil olan xalq və bu xalqa mənsub adam.

**MACƏRA** *is.* [*ər.*] 1. Başa gələn həyəcanlı hadisə; qəziyyə, sərgüzəşt. *Onun başına böyük macəralar gəlmişdir. – Nabat zənn edirdi ki, Şəkərəli bir şey bilmir və onu dilgir, qəmgin edən macəradan xəbərsizdir.* T.Ş.Simurq. *Açmasam dərdimi, kim bilir nə var; Ömrümün qaranlıq macərasında?* M.Müşfiq.

2. B a x **avantüra**. // Ümumiyyətlə, hadisə, qəziyyə, əhvalat. *Dildən-dilə düşdü bu fəsanə; Faş oldu bu macəra cəhanə.* Füzuli.

**MACƏRAÇI** *sif.* və *is.* Macəra (2-ci mənada) sevən, macəra axtaran, macəra düzəldən adam; avantüraçı. [Fəxrəddin:] *Mənə Bağdada yola düşdüyüm zaman Bağdadın cadugər və macəraçılar, hiyləgərlər* [şəhəri] *olduğunu demişdi.* M.S.Ordubadi. *Hər cür macəraçılar və başında zərərli fikirlər daşıyanlar susdurulmalıdır!..* M.İbrahimov.

**MACƏRAÇILIQ** *is.* Macəra sevmə, macəraya meyil; avantüraçılıq.

**MAÇ[1]** *is. dan.* Öpüş, öpmə. [Təlxək əcinnə:] *..Barı heç olmasa o şirin dodaqlarından mənə bir maç ver.* Ə.Haqverdiyev. ☐ **Maç eləmək** *dan.* – öpmək, öpüş almaq.

**MAÇ[2]** *is. məh.* Lobyanın və s. sarmaşan bitkilərin sarınması üçün yerə sancılan ağac.

**MAÇA** *is.* 1. Qoyun və başqa heyvanların dirsəkdən aşağı bilək hissəsi. *Maça əti. Maça bozbaşı.*

2. İri aşıq, böyük aşıq (b a x **aşıq**[2] 1-ci mənada). *Aşıqların irisi və xırdası olardı. Xırdasına aşıq, bir qədər irisinə isə maça deyərdilər.* H.Sarabski.

3. *məc. dan.* Həyasız, sırtıq, abır-həya bilməyən adam haqqında. *Maçanın biridir.*

**MAÇAMAÇ** 1. *zərf* Marçıltı ilə, marçıltı səsi çıxararaq, marçamarçla. *Maçamaç öpmək.*

2. *is.* Bir-birini öpmə (çoxları haqqında) .

**MAÇA-MAÇA** *is.* Maça ilə oynanılan uşaq oyunu; aşıq-aşıq. *Uşaqlar maça-maça oynayırlar.*

**MÁDAM** *bağl.* [*ər.*] Cümlənin əvvəlində gəlib, məzmununda güzəşt olmayan cümləyə güzəştlik xüsusiyyəti verir – bu səbəbə görə ki, buna görə ki (çox vaxt "ki" bağlayıcısı ilə işlənir). [Bəhram:] *Madam ki, .. insanlar məkr və təzvir ilə öz məqsədlərinə yetişirlər, nə səbəbə mən hiylə qarşısında hiylə işlətməyim?* C.Cabbarlı. [Bəhlul:] *Madam ki, açıq söhbətə çağırırsan, bu da sənin üçün açıq söhbət.* İ.Hüseynov.

**MADÁM** [*fr.*] Fransada, 1917-ci il inqilabından qabaq isə Rusiyada və bəzi başqa ölkələrdə: ərli qadına (adətən familiyasına qoşularaq) müraciət edilərkən işlədilir; xanım. "*Madam Bovari*" *romanı.* // *köhn.* Qadın (adətən "avropalı qadın") mənasında. *Beş deyil, on beş deyil, hər yan baxırsan var madam; Ev madam, mənzil madam, balkon madam, talvar madam.* M.Ə.Sabir. *Əyləşmiş ikisi, qozlada qazaq; Yanlarında madam, edirlər mazaq.* H.K.Sanılı.

**MADAPOLAM** [coğr. addan] Adətən alt paltarlıq, sıx ağ pambıq parça. // Həmin parçadan tikilmiş. *Madapolam köynək.*

**MADAR** *sif.* [*ər.*] Ən istəkli, ən əziz; arxa, ümidgah (övlad haqqında). [Qarı:] *..Ay xanım, madar bir qızım var.* "Abbas və Gülgəz". [Güldanə:] *Bilirsiniz ki, mən ata-anamın madar qızıyam.* Ə.Vəliyev. [Gilə:] *Mənim də varım-dövlətim o madar oğlumdur.* Ə.Abasov.

**MADDƏ[1]** *is.* [*ər.*] 1. Təbiətdəki fiziki cisimlərin əsasını təşkil edən şey. *Qida maddələri. Zəhərləyici maddələr. Üzvi maddələr.* // Cisim, şey.

2. B a x **materiya** 1 və 2-ci mənalarda.

3. *dan.* Bədənin bir yerində gizli illət, açılmamış yara; irinlik. ☐ **Maddə etmək (eləmək)** *dan.* – bədənin bir yerində irin əmələ gəlmək, çirk etmək.

4. *məc.* Keyfiyyət; zireklik, bacarıq, çoxbilmişlik mənasında. [Ağa Hüseyn:] *Bala, bu maddə ki səndə var, inşallah, gələcəkdə böyük sövdəgər olarsan.* Ə.Haqverdiyev. // *zar. dan.* Bu cür keyfiyyətlərə malik olan adam haqqında. *Zirək maddədir. O elə bir maddədir ki...*

◊ **Maddələr mübadiləsi** *fiziol.* – canlı orqanizmlərdə maddələrin xarici mühitlə qarşılıqlı əlaqə şəraitində həzm olunması ilə bağlı olan proseslərin məcmusu.

**MADDƏ²** *is.* [*ər.*] 1. Rəsmi bir sənəddə, siyahıda, lüğətdə və s.-də müstəqil bölgü; bənd, paraqraf. *Cinayət kodeksinin beşinci maddəsi.* – [Mindilli:] *Bax, bununla aktdakı maddələri heçə çıxartdın*. S.Rəhman.

2. *mal*. Büdcədə və s.-də gəlirin mənbəyini və ya məxaricin yerini göstərən hissə. *Gəlir maddəsi.*

**MADDƏBƏMADDƏ** *zərf* [*ər.* maddə və *fars.* ...bə...] Maddə-maddə, bəndbəbənd; maddələr üzrə. *Qərarı maddəbəmaddə müzakirə etmək.*

**MADDİ** *sif.* [*ər.*] 1. Şüurdan asılı olmayaraq mövcud olan; cismani, fiziki. *Maddi varlıq. Maddi aləm*. // Maddəyə aid olan.

2. Pula, mala, mülkə aid olan. *Maddi kömək. Maddi imkan. Maddi nemətlər. Maddi vəziyyət. – Qonşu hökumətlər Atabəylər ölkələrinin işinə müdaxilə etmək üçün din hamilərinə maddi və mənəvi köməkdə bulundular*. M.S.Ordubadi. *Kimsə* [Zeynalı] *sevməyir, müdafiə etməyir, mənəvi və maddi müavinətdə bulunmayırdı*. S.Hüseyn.

◊ **Maddi sübut** *hüq*. – cinayətlə bağlı olan və onun açılmasına imkan yaradan şey(lər).

**MADDİLƏŞMƏ** "Maddiləşmək"dən *f.is.*

**MADDİLƏŞMƏK** *f.* Maddi şəkil almaq, konkret şəkil almaq.

**MADDİLİK** *is.* Maddədən ibarət olma, maddi şeyin xassəsi (*mənəvilik* ziddi). // Şüurdan asılı olmayaraq mövcud olma; cismanilik.

**MADDİYYAT** *is.* [*ər.*] *klas.* Maddi, cismani şeylər (*mənəviyyat* əksi).

**MADERA** [coğr. addan] Tünd üzüm şərabı növü.

**MADƏR** *is.* [*fars.*] *klas.* Ana. *Madərləriniz etdi sizə mehrü məhəbbət; Ağuşi-şəfəqqətdə sizi bəslədi rahət.* M.Ə.Sabir. *Bəşşaş oturub yanında madər; Hərdən beşiyi əlilə yellər.* A.Səhhət.

**MADƏRŞAHLIQ** *is. tar.* Qadın qohumluğu xəttinə əsaslanan və qadının hakim olduğu qəbilə qruplarından ibarət ibtidai icma quruluşu forması; matriarxat.

**MADMAZEL** [*fr.*] Fransada, 1917-ci il inqilabından qabaq isə Rusiyada və bəzi başqa ölkələrdə: adətən kübar qızların, yaxud subay qadınların adlarına qoşulan söz; xanım. [Məmdəli:] *Mən ki, bir şux madmazel eşqində əldən getmişəm!* M.Ə.Sabir. *Maşın sahibi madmazel; Əylənmək üçün iti gəzdirir.* N.Rəfibəyli.

**MADÓNNA** [*ital.*] Katoliklərdə: İsanın anası sayılan Məryəmə verilən ad, habelə onun heykəli və ya şəkli.

**MADYAN** *is.* [*fars.*] Dişi at. *Boğaz madyan. – Tağı əmi .. atları suvarmağa göndərəndə, mənə də boz madyana minməyə izin verdi.* S.S.Axundov.

**MADYAR** *is.* Macarların özlərinə verdikləri ad.

**MAÉSTRO** [*ital.*] Bəstəkara, dirijora və ya başqa görkəmli incəsənət xadiminə hörmət üçün verilən ad.

**MAƏDA** [*ər.*] *köhn.* Başqa, əlavə. *Bunlardan maəda, Vaqifin .. yazdığı müxəmməsin məali-pürməzmunu həmişə doğruluq üzrə qalıb...* F.Köçərli. *Rzaquluxanın İran səfərinə məktəb və darülfünun yoldaşlarından maəda, mürəbbiyəsi olan Mariya xanım da böyük maneələr göstərməkdə idi.* M.S.Ordubadi.

**MAFAR** *is.* [*ər.*] İmkan, macal. □ **Mafar verməmək** – tələsdirmək, macal verməmək. [Faytonçu:] *Adə, çöllü balası, ağzını açıb hara baxırsan, otur gedək, yoxsa vağzalın xəzpuşları mafar verməz, heybəni çiynindən, papağını başından elə çarpışdırar ki, sonra ağzın bir saat açılı qalar.* Ə.Məmmədxanlı.

**MAFƏ** *is.* [*ər.*] İçərisinə tabut qoyulub aparılan xərək. *Səlim qocanı yudu, kəfənlədi, sonra mafəyə qoydu, həmən dediyi gül ağacının dibində basdırdı.* (Nağıl). *Əzizim, qönçə gedər; Gül açmaz, qönçə gedər; Mafənin qabağında; Əllərdə xonça gedər.* (Bayatı).

**MÁFİYA** *is.* [*ital.*] Terror yolu ilə məqsədini həyata keçirən gizli təşkilat və ya cəmiyyət. *Mağaraya təpilmiş neçin o qart canavar; ..Mafiyası üstündə əsim-əsim əsənlər; Fürsət düşsə əlinə, pambıqla baş kəsənlər!* X.Rza.

**MAFRAC, MAFRAŞ** b a x **məfrəş**. *Bu xəbəri anam da eşidən kimi dinməz-söyləməz mafracını açdı və şeyləri bükdü, qoydu yerinə.* C.Məmmədquluzadə. *Qoca kiçik qızı atdan düşürtdü və sonra ata çatılmış iki mafraşı açıb yerə saldı.* S.S.Axundov.

**MAFRAQ** *sif.* Etibarsız (əşya haqqında), korlanmış, xarab olmuş.

**MAGİSTR** [*lat.* magister – müəllim] Elmi dərəcə, habelə belə dərəcəsi olan şəxs.

**MAGİSTRAL** [*lat.* magistralis – yönəldici, əsas] 1. Hər hansı bir yolun əsas xətti. *Dəmiryol magistralı. Su magistralı. Magistral şose yolu.* // Böyük şəhərlərin ən çox hərəkət olan küçəsi. *Magistral küçə.*

2. Elektrik, teleqraf, telefon, kanalizasiya və ya su şəbəkəsi sistemində əsas kabel (xətt) və ya boru. *Elektrik magistralı. Magistral qaz kəməri.*

**MAGİYA** *is.* [*lat.*] Sehrbazlıq, cadugərlik, ovsunçuluq.

**MAĞAR** *is.* Toy, yas və s. məclislər üçün qurulan böyük çadır. *Dəfn mərasimindən sonra, qurulmuş iri mağarda xeyrat verildi.* Çəmənzəminli. *Dörd-beş çadırı bir-birinə calayıb həyətdə meydan kimi bir mağar qurmuşdular.* B.Bayramov.

**MAĞARA**[1] *is.* [*ər.*] 1. Dağ və qayanın içinə doğru uzanan, yaxud yer altında olan geniş oyuq; zağa, kaha. *Ayı mağarası. – Dəmirçioğlu bir ətrafa baxıb gördü, yolun kənarında bir mağara var.* "Koroğlu". *Qaraca qız* [ayıdan] *fürsət tapıb, özünü dərənin döşündəki mağaraya saldı.* S.S.Axundov.

2. *məc. zar.* Kiçik, yaraşıqsız ev, məskən, daxma mənasında. [Qarovul:] *Dəstəbaşımız da öz mağarasında əyləşib, üç gündür nə isə bizimlə danışmaq istəməyir.* Ə.Haqverdiyev.

**MAĞARA**[2] *is.* Sap çarxı, qarqara.

**MAĞAZA** *is.* [əsli *ər.* "məxazin"dən] Böyük dükan, iri ticarət müəssisəsi. *Bakı universal mağazası. – Hər küçədə bir və ya iki xırda dükandan başqa .. bütün mağaza və dükanlar bağlıdır.* M.İbrahimov. *Mağaza və pavilyonların al-əlvan titrək illüminasiyası, bəzəkli vitrinlər adamsız çox qüssəli göründü.* Q.İlkin.

**MAĞUL** "Heç olmazsa", "nə yaxşı ki", "əcəb ki" mənalarında işlədilən ara söz. [Abbas:] *Qarı nənə, imanın kamil olsun, mağul dərdlilərin dərdinə qalırsan...* "Abbas və Gülgəz". *Mağul keçən vaxtlar dəvə karvanları düzülürdü yola, ticarət malını yükləyirdik dəvələrə.* C.Məmmədquluzadə.

**MAH** *is.* [*fars.*] Ay. // Klassik şeirdə gözəlin surətinə işarədir. *Görsən üzün ol mahın, bas bağrına gərduntək; Dön başına yalvarə-yalvarə, salam eylə!* M.V.Vidadi. *Gər desəm aydı yer üstündə gəlib rəftarə; Əql bavər eləməz, mah səmadən düşməz.* S.Ə.Şirvani.

**MAHAL**[1] *is.* [*ər.* məhəll] *tar.* Dövlət ərazisinin müəyyən idarəçilik sahəsi (inzibati-siyasi, təsərrüfat, hərbi və s.) üçün ayrılan hissəsi. *Gəncə-Şirvan mahalı. – Molla Pənah Vaqif dəxi .. Qarabağa səfər edib və Cavanşir mahalında Tərtərbasarda bir müddət sakin olub.* F.Köçərli. *Tanındı mahalda on beş yaşından; Bahadırın adı dillərdə gəzdi.* B.Vahabzadə.

**MAHAL**[2] *sif.* [*ər.* mühal] Çətin əmələ gələn, mümkün olmayan, baş tutmayan, qeyri-mümkün. *Mahal işdir. – Cəhani tərk edərəm, cümlə dövlətü varı; Mahaldır eləmək böylə növcəvan tərkin.* X.Natəvan. *Qəti surətdə vazeh oldu mənə; Ki, mahal əmrdir, dönəm vətənə.* A.Səhhət. ☐ **Mahal olmaq** – çətin əmələ gəlmək, çətin başa gəlmək. *Əhli-halı görmək istər əhli-hal; Müzayiqə etmə, gər olsa mahal.* Aşıq Pəri.

**MAHARÁCA** *is.* [*sanskr.*] Hindistanda hökmdar titulu. Orta əsrlərdə iri feodallara, müstəqil knyazlıqların hakimlərinə, yeni və ən yeni dövrlərdə isə bəzi knyazlara verilmişdir.

**MAHÁTMA** *is.* [*sanskr.*] 1. Hind mifologiyasında dünya ruhu, "ilahi insan".

2. Hindistanda görkəmli, xüsusi ehtiram bəslənilən adamların adına əlavə.

**MAHİR** *sif.* [*ər.*] Məharətli, bacarıqlı, qabiliyyətli, işini əla bilən, usta. *Mahir çalğıçı. Mahir rəssam. –* [Ağa Kərim:] *Axır eşitdim ki, qardaşın arvadına vəkil olubdur, onun tərəfindən mürafiəyə duracaq. Belə işlərdə o çox mahirdir.* M.F.Axundzadə. *Can usta, mahir usta, gərək işin iş olsun; Çıraqban göylər kimi eyvanın geniş olsun.* M.Müşfiq.

**MAHİRANƏ** *zərf* [*ər.* mahir və *fars.* ...anə] Məharətlə, ustalıqla, mahircəsinə. *Mahiranə təsvir etmək.*

**MAHİRCƏSİNƏ** b a x **mahiranə**.

**MAHİRLƏŞMƏ** "Mahirləşmək"dən *f.is.*

**MAHİRLƏŞMƏK** *f.* Mahir olmaq, ustalaşmaq, məharət qazanmaq. *Ovçuluqda mahirləşmək. –* [Mirzə Həsən:] *Uşaqlarımız əkinçilik işlərində də mahirləşirlər.* Ə.Haqverdiyev.

**MAHİRLİK** *is.* Mahir olma; məharət, ustalıq. *Mahirlik göstərmək. – Mollalardan o yana oturmuş hacılar başmaqların hər tərəfinə mahirlik ilə tutulmuş güləbətini görüb mat və mütəhəyyir qalardılar.* Çəmənzəminli.

**MAHİYYƏT** *is.* [*ər.*] 1. Daxili məzmun, xüsusiyyət, əsil məna, məğz, əsas. *Məsələnin mahiyyəti. – Ona arxayınsan ki, bu işlərin mahiyyətini və sirrini duymayacaqlar?* C.Məmmədquluzadə. [Çiyələk] *sorğu-sual eləmədi, lakin mahiyyətinə də enmədi.* B.Bayramov.

2. *fəls*. Əşya və hadisələrin dərin əlaqə və münasibətlərini müəyyən edən daxili əsası.

**MAHLIC** *is.* [*ər.* məhluc] Çiyidi təmizlənmiş, çiyidsiz pambıq. *Cərgə pambığından alaq vurulsun: Misir mahlıcından qalaq vurulsun.* R.Rza. *Təpənin üzərində pambıq mahlıcını andıran duman dayanmışdı.* Ə.Vəliyev.

**MAHLICLAMA** "Mahlıclamaq"dan *f.is.*

**MAHLICLAMAQ** *f.* Çiyidli pambığı maşında və ya başqa üsulla təmizləyib mahlıc halına salmaq, pambığın çiyidini təmizləmək.

**MAHLICLANMA** "Mahlıclanmaq"dan *f.is.*

**MAHLICLANMAQ** *məch.* Mahlıc halına gətirilmək, çiyidi təmizləmək (pambığın).

**MAHLİQA** *is.* və *sif.* [*fars.* mah və *ər.* liqa] *klas.* Ayüzlü, gözəl. *Pərdə çək çöhrəmə hicran günü, ey qanlı sirişk; Ki, gözüm görməyə ol mahliqadan qeyri.* Füzuli.

**MAHMIZ** *is.* [*ər.*] 1. Xoruz və bəzi başqa quşların ayaqlarının arxasında sivri buynuz çıxıntısı. *Xoruzun mahmızı sınıb.*

2. Minik heyvanlarını mahmızlamaq üçün çəkmənin dabanına taxılan şişdişli kiçicik dəmir çarx. □ **Mahmız vurmaq** – atı, iti yerisin deyə mahmızla vurmaq. *İbrahim qızın əlindən tutub, atın tərkinə aldı, ata biriki mahmız vurub, üzünü vətənə sarı çevirdi.* (Nağıl). *Ağ libas geymiş özgə bir minici; Vurdu mahmız, o da at oynatdı.* A.Səhhət.

3. *bot.* Bəzi bitkilərdə gül kasacığının üzərində nektarın toplanma yeri olan içiboş çıxıntı. *Əsbəçiçəyi, bənövşə və bəzi başqa bitkilərin çiçəklərində tac və ya kasacıqdan xüsusi çıxıntı əmələ gəlir ki, oraya nektar maddəsi toplanır, həmin çıxıntıya mahmız deyilir.* M.Qasımov.

**MAHMIZLAMA** "Mahmızlamaq"dan *f.is.*

**MAHMIZLAMAQ** *f.* 1. Mahmızla basmaq, dürtmək. *Asəf atını mahmızlayıb böyük bir qəsrin qarşısında durdu və sarayı tərif etməyə başladı.* M.S.Ordubadi. *Bu saat işini yüngülləşdirim, – deyə* [Salman] *atı mahmızlayıb can verən tülkünün üstünə səyirtdi.* M.İbrahimov. *O yenə də Xasaya baxır, nə barədə isə düşünür, təkdənbir atını mahmızlayıb başını bulayırdı.* M.Hüseyn.

2. *məc.* Tələsdirmək, bizləmək.

**MAHMIZLI** *sif.* Mahmızı olan, mahmız taxılmış. *Mahmızlı çəkmədən gəlir çınqıltı; Aralıqda olur xırda pıçıltı.* H.K.Sanılı.

**MAHNA** *is. dan.* Bəhanə. *Mahna axtarmaq. Mahna tapmaq. – Qızıldan tanası var; Əlində hanası var; Gözləyirəm, gəlməyir; Yəqin bir mahnası var.* (Bayatı). [Bədircahan:] *Züleyxa xanım gəlib buradan Leyla xanım ilə, bir yer var, oraya gedəcəklər. Bu mahnadır məhz səni görməkdən ötrü.* N.Vəzirov.

**MAHNI** *is.* Nəğmə, hava, şərqi. *Mahnı oxumaq. – Sovqat gətirər quşlar; Sizə gözəl mahnılar.* A.Səhhət. [Vaqif:] *Qapıçı, qapıçı, çağır gedəni! Oğul! Lap oyatdı o mahnı məni.* S.Vurğun. □ **Mahnı demək (oxumaq)** – səslə nəğmə oxumaq. *Çobanlar düdük çalar, mahnı oxuyar, dadlı-dadlı söhbət edərdilər.* A.Şaiq. *Ətrafda quşlar batıb gedən günəşə son mahnılarını oxuyurdular.* S.Rəhman.

**MAHPARƏ** *is.* [*fars.*] Ay parçası (gözəlin epitetlərindən biri). *Yüz qönçə dəhənli mahparə; Gül suyu səpərdi rəhgüzarə.* Füzuli. *Bu yarə bircə baxın, mahparədir, deyəsən.* C.Cabbarlı.

**MAHRU, MAHRÜXSAR(LI)** *is.* və *sif.* [*fars.*] *klas.* Ayüzlü (gözəlin epitetlərindən biri). *Sənin layiqin qəsri-şəhdir müdam; Kənizin ola mahrulər təmam.* M.Ə.Sabir.

**MAHRUX** *sif.* b a x **mahru**.

**MAHTAB** *is.* [*fars.*] Ay aydınlığı, aylı gecə. *Mən fələk ayını göydə görmüşəm; Yerdə sənin kimi mahtab olmaz!* Qurbani.

**MAHTABLI** *sif.* Aylı, işıqlı, aydın (gecə haqqında). *Mahtablı gecə.*

**MAHUD** *is.* Üz tərəfi keçə kimi basıq yun və ya yarımyun parça. *Bahadır mahud almaq fikri ilə bir mağazaya varid oldu.* N.Nərimanov. *Stolların üstünə o qədər də əla olmayan qırmızı mahuddan örtük çəkilmişdi.* M.İbrahimov. // Bu parçadan tikilmiş. *Mahud palto. – Aylar ilə işlənmiş mahud külahı dala tərəf sürüşmüşdü.* A.Divanbəyoğlu.

**MAHUR** *is. mus*. Azərbaycan klassik muğamlarından birinin adı.

**MAHUR-HİNDİ** *is.* Azərbaycan klassik muğamlarından birinin adı.

**MAX** *dan.*: **max verməmək** – fikir verməmək, baş qoşmamaq, özünü o yerə qoymamaq, qarışmamaq.

**MAXİST** [*xüs. is.*-dən] Maxizm tərəfdarı.

**MAXİZM** [*xüs. is.*-dən] XIX əsrin sonunda fəlsəfədə və nəzəri fizikada subyektiv idealist cərəyan.

**MAXORKÁ** [*rus.*] 1. Yarpaq və saplaqlarından tənbəki hazırlanan bitki. *Maxorka əkini.*

2. Həmin bitkinin xırda doğranmış yarpaq və saplaqlarından hazırlanan alçaq növlü tənbəki, tütün. *Maxorka çəkmək.* [Xəlil Mirzə] *maxorka tüstüsündən və kəsif havadan bir dəqiqə də olsun çimir eləyə bilmədi.* Q.İlkin.

**MAİL** *sif.* [*ər.*] 1. Hər hansı bir tərəfə əyilmiş; meyilli. *Mail xətt. Mail səth. Mail divar. – Aşağı enən günəş də öz mail şüaları ilə gözləri qamaşdırırdı.* Mir Cəlal.

2. Bir şeyə və ya bir kəsə meyli olan, istəyi, həvəsi olan. *İnsan insan ilə həmişə ülfət bağlamağa maildir, necə ki heyvan heyvan ilə.* C.Məmmədquluzadə. □ **Mail olmaq** – bir şeyə həvəsi, meyli olmaq; ürəyi istəmək, qəlbi yapışmaq, bağlanmaq. // Meyil etmək. *Amma mən bir yanda orucluq söhbəti düşəndə, çox mail oluram ki, küfr və nasəza danışam.* C.Məmmədquluzadə.

3. Vurğun, sevən, istəyən. *Mən mailəm sənin zənəxdanına; Halqa-halqa zülfipərişanına.* M.P.Vaqif. *Mailəm çeşmi-qəzalə; Olmuşam dərdə həvalə.* Q.Zakir. □ **Mail olmaq** – vurulmaq, sevmək, istəmək. *Gümüş kəmər bağlayıbdır belinə; Danışdıqca mail oldum dilinə.* Xəstə Qasım. *Bir ala gözlüyə mail olmuşam; Yarın qapısında sail olmuşam.* Aşıq Rəcəb.

4. Rəng bildirən sifətlərdən sonra gələrək, bənzər, çalar, oxşar, yaxın mənasında işlədilir. [Xədicə] *rəngi bir qədər qaraya mail bir qız idi.* S.Hüseyn.

**MAİLİ** *sif.* [*ər.*] Bir yana meyil edən; əyilən; düz olmayan, əyri, əyilmiş, meyilli. *Maili xətt. Maili səth. – Yer bir qədər maili olduğundan .. yerimək çətin idi.* M.İbrahimov. *..Günəşin maili şüaları* [Yusifin] *sinəsinə düşür, orden-medalları bərq vururdu.* B.Bayramov.

**MAİLLİK** *is.* Mail şeyin vəziyyəti.

**MAJÓR** [*fr.*] *mus.* Səsləri, böyük və kiçik tersiyadan ibarət akkord təşkil edən musiqi ladı (səslərdə gümrahlıq, şənlik duyulur) (*minor* əksi). *Avropa musiqisi əsas etibarilə iki kök – major və minor əsasında qurulmuşdur.* Ə.Bədəlbəyli.

**MAJORİTÁR** *sif.* [*fr.*] Ayrı-ayrı namizədlər üzrə keçirilən seçki.

**MAKAKA** *is.* [*port.*] Əntərlər yarımfəsiləsindən olan meymun.

**MAKÁO** *is.* [*xüs. is.*-dən] 1. Uzun quyruqlu tutuquşu.

2. Qumar oyunu növü.

**MAKARÓN** [*ital.*] Su və yumurtadan yoğrulmuş buğda unu xəmirinin qurudulmasından hazırlanmış yeyinti məhsulu, habelə ondan hazırlanmış xörək. *Makaron süzmək.* – [Mehribanın] *evdə bir az makaronu, bir az da yağı qalmışdı.* H.Seyidbəyli.

**MAKEDONİYALILAR** *cəm* Yuqoslaviya və Yunanıstan Makedoniyasının, habelə Bolqarıstanın bəzi rayonlarının əsas əhalisini təşkil edən cənubi slavyan xalqı.

**MAKÉT** [*fr.*] Bir şeyin (bəzən əvvəlcədən düzəldilmiş) kiçik nümunəsi; model. [Reyhan:] *Cahangir gedək. Mehribanın düzəltdiyi yeni maketi sənə göstərmək istəyirəm.* İ.Əfəndiyev. *Ən qabaqda gələn birisi əlində maşın maketi tutmuşdu.* Q.İlkin. // *mətb.* Kitab, qəzet, jurnal və s.-nin nümunə üçün hazırlanmış nüsxəsi. *Ensiklopediyanın maketi.*

**MAKETÇİ** *is.* Maket ustası; modelçi.

**MAKETÇİLİK** *is.* Maketçinin işi, peşəsi; modelçilik. *Rəssamlıqda maketçilik xüsusi bir yer tutur.*

**MAKİ** *is.* [*fr.*] 1. Meşənin sıx yeri.

2. İkinci dünya müharibəsi zamanı fransız partizan dəstəsinin adı.

**MAKİAVELLİZM** *is.* [*xüs. is.*-dən] Qarşıya qoyulan məqsədlər naminə əxlaq qanunlarına məhəl qoymamağı və istənilən vasitələrdən istifadə etməyi mümkün sayan, hakimiyyət uğrunda mübarizədə hakimlərin qəddarlığına və xainliyinə bəraət qazandıran siyasət.

**MAKİNA** [*lat.*] 1. Bax **maşın** 1-ci mənada. *Avtomobillərin, tramvayların, adam basmasın deyə, motorlarına bir makina*

*qoyulmuş*(*dur*). Çəmənzəminli. *Dəmir makinalar hey çoxaldıqca; Qaldıq illər boyu ac da, işsiz də.* S.Vurğun. *Bir möhtəşəm makinə; Gur çayların zülfünə; Çəkməzmi darağını?* M.Müşfiq.

2. *köhn.* Yazı maşını, maşınka. *Makinada yazmaq. Məqaləni makinada çap etdirmək. – Saatlarla oturub makinanın dalında; Düzürsən vərəqlərə gələcək kitabları.* S.Rüstəm. [Vahid:] *Anam ağ, zərif barmaqlarını makinadan çəkdi.* B.Bayramov.

**MAKİNAÇI** *is.* Yazı maşınında yazan (qadın). *Sərvərov əmri qaraladı, özü aparıb makinaçıya verdi*. Mir Cəlal.

**MAKİNAÇILIQ** *is.* Makinaçının işi, peşəsi, yazı maşınında çapetmə sənəti. *Makinaçılıq kursu.*

**MAKKARTİZM** *is.* [*xüs. is.*-dən] 1950-ci illərdə ABŞ-da ifrat mürtəce siyasi cərəyan.

**MAKREL** *is.* [*rus.*] Balıq növü.

**MAKSİM** [*xüs. is.*-dən] Xüsusi sistemli dəzgahlı pulemyot.

**MAKSİMALİST** [*yun.*] 1. Maksimalizm tərəfdarı (b a x **maksimalizm** 1-ci mənada).

2. *tar.* Sui-qəsdçi eser qrupunun üzvü.

**MAKSİMALİZM** [*lat.* maximum – daha artıq] 1. Hər hansı bir tələbdə ifrata varma.

2. *tar.* Eserlər arasında ifrat sol sui-qəsdçi cərəyan.

**MAKSİMUM** [*lat.*] Ən böyük miqdar, ən çox miqdar; ən çox, ən böyük (*minimum* əksi). *Maksimum qüvvə sərf etmək.*

**MAKULATURA** [*alm.* makulatur, *lat.* maculare – korlamaq] 1. *mətb.* Çap zamanı xarab olduğundan və ya istifadə olunub qurtardığından təzədən kağız istehsal etmək üçün işlənilən çap kağızı vərəqələri.

2. *məc.* Yararsız, qiymətsiz, zəif ədəbi əsər haqqında.

**MAQ** *is.* [*yun.* əsli *fars.*] Qədim farslarda, midiyalılarda və bəzi başqa xalqlarda kahin, habelə nücum ilə məşğul olan adam. // Sehrbaz, ovsunçu, cadugər, qeybdən xəbər verən adam.

**MAQAZİN** 1. B a x **mağaza**. [Aslan] *çəkmə maqazininə girdi, axırıncı pulunu verib, bir cüt yüngül səndəl aldı.* S.Vəliyev.

2. *is.* Odlu silahların, xüsusən tüfəngin güllə doldurulan yeri.

**MAQQAŞ** *is.* [*ər.*] 1. Çox xırda şeyləri tutub götürmək, sıxmaq və ya qoparmaq üçün kiçik maşayaoxşar alət. *Maqqaşla tük çəkmək.*

2. Xəmirdən hazırlanan şirniyyatın üzünü naxışlamağa məxsus ağzı dilikli kiçik alət. *Şəkərburalara maqqaşla naxış vurmaq*.

**MAQQAŞLAMA** "Maqqaşlamaq"dan *f.is.*

**MAQQAŞLAMAQ** *f.* Maqqaş vurmaq, maqqaşla naxışlamaq.

**MAQQAŞLANMA** "Maqqaşlanmaq"dan *f.is.*

**MAQQAŞLANMAQ** *məch.* Maqqaşla naxışlanmaq, maqqaş vurulmaq. *Şəkərburalar maqqaşlandı.*

**MÁQMA** [*yun.* magma – xəmir] *geol.* Yerin dərin qatlarında yüksək temperatur və təzyiq şəraitində əmələ gələn mürəkkəb tərkibli ərgin od kütləsi (Yer qabığında və ya yer səthində soyuduqda və bərkləşəndə maqmatik süxurlar əmələ gətirir). *Yerin dərin qatlarında maye halında olan maqma kütləsi püskürüb yerin üzünə çıxanda lava adlanır.* M.Qaşqay.

**MAQMATİK** *sif.* Maqmadan ibarət olan. *Maqmatik süxurlar*. // Maqma halında olan; sıyıq, ərgin. *Süxurun maqmatik halı.*

**MAQNÁT** [*lat.* magnatus – kübar, əyan] 1. Avropanın bəzi ölkələrində (xüsusilə keçmişdə feodal-kəndli Polşasında və Macarıstanda) iri feodal, mülkədar.

2. İri sənaye və maliyyə kapitalisti. *Maliyyə maqnatı.*

**MAQNETÍZM** [*yun.*] 1. Maqnitin, habelə bəzi cisimləri özünə tərəf çəkən, yaxud itələyən elektrik gərginliyi, ya da elektrik yükü olan naqilin xassəsi.

2. Maqnit hadisələri və cisimlərdəki maqnit xassələri haqqında elm.

**MAQNÉZİUM** [*yun.*] Yanarkən parlaq ağ alov verən gümüşü-ağ rəngli yüngül, kövrək metal – kimyəvi element.

**MAQNEZİYA** [*coğr. addan*] Maqnezium duzu və ya oksidindən ibarət ağ poroşok (təbabətdə işlədilir). *Ağ maqneziya.*

**MAQNÍT** [*yun.*] Bəzi cisimləri özünə çəkmək və itələmək xassəsinə malik cisim; ahənrüba. *Neftimiz, pambığımız, benzinimiz, maqnitimiz; Güclənir, güclənirik qoşduğumuz cəbhədə biz.* M.Müşfiq. // *məc.* Cazibə qüvvəsinə malik olan adam və ya şey haqqında.

*Mən qərib bir quşam, taleyim deyə; Sevgi maqnitindən qaça bilmərəm.* S.Tahir.

**MAQNİTLƏMƏ** "Maqnitləmək"dən *f.is.*

**MAQNİTLƏMƏK** *f.* Cismə maqnit xassəsi vermək, maqnitli etmək.

**MAQNİTLƏNDİRİLMƏ** "Maqnitləndirilmək"dən *f.is.*

**MAQNİTLƏNDİRİLMƏK** *məch.* Maqnit xassəsi verdirilmək, maqnitli etdirilmək.

**MAQNİTLƏNDİRMƏ** "Maqnitləndirmək"dən *f.is.*

**MAQNİTLƏNDİRMƏK** *f.* Cismə maqnit xassəsi vermək, maqnitli etmək. *Kompasın əqrəbini maqnitləndirmək.*

**MAQNİTLƏNMƏ** "Maqnitlənmək"dən *f.is.*

**MAQNİTLƏNMƏK** *qayıd.* Maqnitli olmaq; maqnitləşmək.

**MAQNİTLƏŞDİRİCİ** *sif. xüs*. Maqnit xassəsi verə bilən, maqnitli edən. *Maqnitləşdirici sarqaclar.*

**MAQNİTLƏŞDİRİLMƏ** "Maqnitləşdirilmək"dən *f.is.*

**MAQNİTLƏŞDİRİLMƏK** bax **maqnitləndirilmək**.

**MAQNİTLƏŞDİRMƏ** "Maqnitləşdirmək"dən *f.is.*

**MAQNİTLƏŞDİRMƏK** bax **maqnitləndirmək**.

**MAQNİTLƏŞMƏ** "Maqnitləşmək"dən *f.is.*

**MAQNİTLƏŞMƏK** bax **maqnitlənmək**.

**MAQNİTLİ** *sif.* Maqnit xassəsinə malik olan, maqniti olan. *Maqnitli cisimlər. – Daşkəsən yatağı maqnitli dəmir yatağı adlanır.* M.Qaşqay.

**MAQNİTOFÓN** [*yun.*] Elektromaqnit vasitəsilə səsi yazan və təkrar edən aparat. Səs siqnallarını maqnit lentinə yazan, sonra isə səsləndirən aparat. *Qaya maqnitofon dilləndi yenə: "Hey, hey! Bir dayan; Şövkətdir oxuyan, Habildir çalan! Bu Tofiq, bu Arif, bu da Cahangir..."* M.Araz.

**MAQNİTÓLA** *is.* [*yun.*] Maqnitofon və radioqəbuledicidən ibarət məişət cihazı.

**MAQNİTÓMETR** [*yun.*] Maqnit sahəsinin gərginliyini ölçən cihaz.

**MAQNİTSİZLƏŞDİRİLMƏ** "Maqnitsizləşdirilmək"dən *f.is.*

**MAQNİTSİZLƏŞDİRİLMƏK** *məch.* Cismin maqnit xassəsi yox etdirilmək, maqnitsiz etdirilmək.

**MAQNİTSİZLƏŞDİRMƏ** "Maqnitsizləşdirmək"dən *f.is.*

**MAQNİTSİZLƏŞDİRMƏK** *f.* Cismin maqnit xassəsini yox etmək, maqnitsiz etmək.

**MAQNİTSİZLƏŞMƏ** "Maqnitsizləşmək"dən *f.is.*

**MAQNİTSİZLƏŞMƏK** *f.* Cismin maqnit xassəsi yox olmaq, maqnitsiz olmaq.

**MAQNÓLİYA** [*xüs. is.*-dən] *bot*. Ətirli iri və ağ çiçəkləri olan ağac və ya kol-bitki.

**MAQNÓN** *is.* [*lat.*] Kvant nəzəriyyəsinin mühüm anlayışlarından biri.

**MAL¹** *is.* 1. İribuynuzlu ev heyvanı; mal-qara, qaramal (inək, öküz, camış və b.). *Malı naxıra qatmaq. Mal damı*. – [Dərviş:] *Malların köyşəyi, atların nəriltisi, gah-gah da itlərin mırıltısı qulağıma gəlirdi.* A.Divanbəyoğlu. □ **Mal həkimi** – baytar həkimi. // *top.* İribuynuzlu heyvan sürüsü. *Mal qapıya gələndə axşam, səhər; Qoyun mələr, quzu mələr, mal mələr.* A.Şaiq.

2. *dan.* Fərasətsiz, dilsiz, düşüncəsiz, key adam haqqında. *Malın biridir*. – [Qumru:] *Bizimki malın, məğmunun biridir, lap düz buyurursan!* Mir Cəlal. [Şair Nağı:] *Kənd içində olanda diliniz ötür; Çöldə dönürsünüz mala, göyçəli!* "Aşıq Ələsgər".

◊ **Mal kimi gözünü döymək** – kütcəsinə baxmaq, tənbəl-tənbəl baxmaq. [Rüstəm traktorçulara:] *Ə-ə, sizinləyəm ey, nə mal kimi gözünüzü döyürsünüz?* M.İbrahimov.

**MAL²** *is.* [*ər.*] 1. Qiyməti olan və cəmiyyətdə alğı-satqı yolu ilə paylaşdırılan əmək məhsulu; ümumiyyətlə, alver obyekti olan hər şey; əmtəə. *Çoxişlənən mallar.* – [Xortdan:] *Dükanın içində beş-on manatlıq mal yoxdur*. Ə.Haqverdiyev. *Məscidin alçaq qapısından hamballar motal və başqa baqqal malları çıxarırdılar.* Çəmənzəminli.

2. Parça, arşınmalı (çit, mahud, ipək və s.). [Hacı Qara:] *Heç kəs malın üzünə baxmır.* M.F.Axundzadə. *Aslan əynindəki qara mahud paltonu və eyni maldan tikilmiş şapkanı çıxararaq asılqana taxıb, Rüstəm kişi ilə üz-üzə əyləşdi.* M.İbrahimov.

3. Var-dövlət, sərvət; mal-əmlak. *Dünyanın malı; Cahü cəlalı; Şövqü vüsalı; Bu balama qurban!* (Layla). *Əlli yol çapıllam, yüz yol talannam; Bir şey deyil dövlət, mal, incimərəm.* Aşıq Ələsgər. *Dəstədə olan adamların biri Mir Qasımdır ki, doğma bacısı Səkinənin malını yemək qəsdi ilə saxta kağız düzəltmişdi.* C.Məmmədquluzadə.

4. *məc. vulq.* Gözəşirin qadın (qız) haqqında. [Cahangir ağa:] *Heç görürsən, bu Həsən kişinin qızı Gülnisə nə maldır?* Ə.Haqverdiyev. [Qarı Xuramana:] *Nə xanların malısan?* S.Vurğun.

**MALA** *is.* [*fars.*] 1. Binanın iç və bayır divarlarına çəkmək üçün əhəng, sement və s. qatışığından ibarət suvaq, palçıq. *Mala tutmaq.* // Həmin qatışığın, binanın içinə və bayır divarına, bəzən də səqfinə çəkilən bərkimiş qatı; suvaq. *Divarın malası qopub yerə töküldü. – Otağın divarları tikiləndə necə mala çəkilib suvanmışdısa, elə də qalmışdı.* B.Bayramov.

2. B a x **malakeş** 2-ci mənada. *Mala ilə divarı suvamaq.*

3. Şumlanmış torpağın kəsəklərini əzmək və hamarlamaq üçün kənd təsərrüfat aləti. *Malanı təmir etmək. – Kəsəkli ağır torpaqlarda diskli malalardan istifadə edilir.* // Şumlanmış torpağın kəsəklərini əzib hamarlama işi. [Rüstəm kişi:] *Orada qarğıdalı əkəcəyəm. Malasın .. traktor ilə çəkəcəyik.* M.İbrahimov.

**MALAALTI** *sif.* Malanın altı üçün olan, suvağın altından vurulan. *Malaaltı taxta.*

**MALABAXAN** *is.* Mal-qaraya qulluq edən şəxs. *Malabaxanların yarışı.* // Sif. mənasında. *Malabaxan qadın.*

**MALAÇƏKƏN, MALAÇI** b a x **malakeş** 1-ci mənada.

**MALAÇILIQ** b a x **malakeşlik**.

**MALAX** *is. bot.* Əncir növü. *..Azərbaycanda qiymətli əncir sortlarından tabaq əncir, malax əncir, sumax əncir sortlarını göstərmək olar.* İ.Axundzadə.

**MALAXÍT** [*yun.*] Müxtəlif xırda məmulat hazırlamaq və mis almaq üçün xammal kimi işlədilən açıq-yaşıl rəngli mineral.

**MALAKAN** [*rus.*] Malakanlıq təriqətinə mənsub adam (b a x **malakanlıq**). [Hacı Qurban:] *..Atam sənə qurban, mənim qorxum o birəhm malakanlardandır.* N.Vəzirov. [Gövhər xanım:] *Deyirlər axtarsan, şəhərdə malakanlardan yaxşısını taparsan.* İ.Hüseynov. □ **Malakan furqonu** *köhn.* – malakan ustalar tərəfindən düzəldilən üstü çadırlı, dördçarxlı araba. *Üstü çatmalı malakan furqonu məscidin qabağında dayandı.* Mir Cəlal.

**MALAKANLIQ** *is.* Pravoslav mərasimlərini və kilsə iyearxiyasını qəbul etməyən, xristian məzhəbinin nümayəndəsi, həmin məzhəbdən olan.

**MALAKEŞ** *is.* [*fars.*] 1. Binaların divarlarına mala çəkən usta; suvaqçı, malaçəkən, malaçı. *Malakeşlər briqadası. – Bakıda ümumiyyətlə peşəkarlar – bənna, xarrat, dəmirçi, rəngsaz, malakeş və sair çox olardı.* H.Sarabski.

2. Suvaq çəkmək üçün alət; mala, kəmçə. *Malakeşi təmizləmək.*

**MALAKEŞLİK** *is.* Malakeşin sənəti, peşəsi; suvaqçılıq, malaçılıq.

**MALALAMA** "Malalamaq"dan *f.is.*

**MALALAMAQ** *f.* 1. Divara mala çəkmək; suvaqlamaq. *Evi malalamaq.*

2. Şumlanmış yerin kəsəklərini mala ilə əzmək, hamarlamaq. *Şamama və onun yoldaşları tarlanı mükəmməl surətdə malalayıb üstündən ensiz zolaqlar çəkdilər.* İ.Əfəndiyev.

3. *məc.* Üstünü örtmək, ört-basdır etmək, açmamaq, faş etməmək (sözün, işin, hadisənin və s.). [Odabaşı:] *Belə danışıqlar ilə sözlərini malalayırdısa da, elə ürəklərə bir şəkk toxumu səpirdi.* Ə.Haqverdiyev. *..Leylək Gəray ağa Cavanşirdə doğa biləcək hər hansı şübhəni malalamağa çalışdı.* S.Rəhimov.

**MALALANMA** "Malalanmaq"dan *f.is.*

**MALALANMAQ** *məc.* 1. Mala çəkilmək, suvanmaq (divar və s.). [Su] *..hamamın ağ gəc ilə malalanmış* (f.sif.) *divarlarına və səqfinə elə bir səs salmışdı ki, guya özgə bir danışığa macal vermək istəmir.* C.Məmmədquluzadə.

2. Şumlanmış yerin kəsəkləri mala ilə əzilmək, hamarlanmaq. *Nəcəf dümdüz və hamar şumlanıb malalanmış* (f.sif.) *sahənin başında durmuşdu.* M.İbrahimov.

**MALALATDIRMA** "Malalatdırmaq"dan *f.is.*

**MALALATDIRMAQ** *icb.* 1. Divara mala çəkdirtmək; suvatdırmaq. *Otağı malalatdırmaq.*

2. Mala ilə şumlanmış yerin kəsəklərini əzdirmək, hamarlatdırmaq. *Sahəni malalatdırmaq*.

**MALALATMA** "Malalatmaq"dan *f.is.*

**MALALATMAQ** *icb.* 1. Mala çəkdirmək; suvatmaq. *Divarları malalatmaq.*

2. Mala ilə şumlanmış yerin kəsəklərini əzdirmək, hamarlatmaq. *Pambıq tarlasını malalatmaq*.

**MALALI** *sif.* Mala çəkilmiş, malalanmış, malası olan. *Malalı divar.*

**MALAMAL** *sif.* və *zərf* [*fars.*] Dolu, dop-dolu, ləbələb, ağzına qədər. *Malamal doldurmaq. Teatr malamal idi. – Məscid bir sinif xalqdan malamal idi.* M.F.Axundzadə. *Oxudurdu neçə nəfər ətfal; Məktəbi olmuş idi malamal.* S.Ə.Şirvani.

**MALAŞƏRİK** *sif.* Ümumi mal və ya dövlətdə hissəsi, payı olan. *Malaşərik* (z.) *olmaq. Malaşərik adam.*

**MALAY** *sif.* və *is. köhn.* Gənc, cavan, yeniyetmə. *Malay uşaq.* – [Balaqardaş:] *..Sənin bir malay nökərin var idi, o necə oldu?* N.Vəzirov.

**MALAYLAR** *cəm* Malay arxipelaqı adalarında və Moluk yarımadasında yaşayan tayfa və xalqlar qrupu.

**MALBAŞ** *sif. dan.* Axmaq, gic, səfeh, qanmaz, kütbeyin. // Bəzən söyüş kimi işlənir. [Məşədi Cahangir:] *Sənə kim demişdi, hökumətdən qaçanlara yorğan-döşək açasan, malbaş oğlu malbaş!* Mir Cəlal.

**MALBAŞLIQ** *is.* Axmaqlıq, giclik, səfehlik, qanmazlıq, kütbeyinlik.

**MALCANLI** *sif.* 1. Öz malının qədrini bilən, öz malını qoruyan, ona qayğıkeşlik göstərən.

2. B a x **malpərəst**.

**MALCANLILIQ** *is.* Malcanlı adamın xasiyyəti, öz malını qoruma, malının qayğısına qalma.

**MALÇƏKƏN** b a x **qapançı**.

**MAL-DAVAR** b a x **mal-qara**.

**MALDAR** *is.* [*ər.* mal və *fars.* ...dar] Ev heyvanları saxlamaqla məşğul olan kəndli və ya kənd təsərrüfatı. // Sif. mənasında. *Bahar fəsli maldar kəndlilər buraya köçüb alaçıqlar qurarlar və orada .. mallarını otladarlar.* S.S.Axundov.

**MALDARLIQ** *is.* Kənd təsərrüfatı sahəsi kimi mal-qara saxlamaqla məşğul olma. *Kəndin camaatı hamısı maldarlıqla güzəran edir, heç kəs cürət edib kənara süd sata bilməzdi.* Ə.Haqverdiyev. // Sif. mənasında. *Maldarlıq briqadası.*

**MALDİLİ** *is. bot.* Üstü tikanlı, yarpaqsız, enli, ətli gövdəsi olan cənub bitkisi; kaktus.

**MAL-DÖVLƏT** *top.* [*ər.*] Sərvət, dövlət, əmlak, var. *Mal-dövləti əlindən çıxmaq.* – [Yaşlı kişi:] *Görünür, Çopurun mal-dövləti* [Şirinnazın] *gözünü tutmuşdu.* S.Hüseyn. *Gəzdim dağı, dağlığı; Yoxdu onun bağlığı; Mal-dövlət gedər qalmaz; Qalar bir cansağlığı.* (Bayatı).

**MAL-HEYVAN** b a x **mal-qara**. *Dastanın sonrasını eşitmək üçün camaat axşam olmağı gözlədi. Elə ki, şər qarışdı, camaat mal-heyvanını rahat elədi, yenə toy evinə toplaşdılar.* "Aşıq Ələsgər".

**MALXULYA** *is.* [*ər.* əsli *yun.*] Qara sevda, qara fikirlər; qəmgin, tutqun əhval-ruhiyyə; insanda baş verən səbəbsiz ruh düşkünlüyü. *Elektrik çıraqları yandı və məni də qaranlıq malxulyasından oyatdı.* C.Məmmədquluzadə. □ **Malxulya etmək** – fikrə, xəyala dalmaq. *Axund Mirqasım malxulya edə-edə məscidin yolunu tutdu.* S.Rəhman.

**MALXULYAÇI** *sif.* Malxulya edən; malxulyaya meyilli adam.

**MALİK** *is.* [*ər.*] Sahib, yiyə. *Başqa-başqa səciyyəyə malik bu adamların adları da səciyyələrinə müvafiq idi*. Çəmənzəminli. *İskəndər hərəkət etmək, fəaliyyət göstərmək, yaratmaq üçün çırpınan bir ruha malikdir*. M.İbrahimov. □ **Malik olmaq** – sahib olmaq. *İstərdim o da mən kimi bir hörmətə çatsın; Ta qol gücünə malik olub şöhrətə çatsın.* M.Ə.Sabir. *Heydər atasının dövlətinə tək oldu malik və işi gəldikcə başladı tərəqqi eləməyə.* C.Məmmədquluzadə.

**MALİKANƏ** *is.* [*ər.* malik və *fars.* ...anə] Mülkədar mülkü, mülkədara məxsus ev və ona yapışıq bağ, bağça və s. [Qatır Məmməd:] *Əlyar xanın atlıları kənddən üzüaşağı enir, xanın qonşu kənddəki malikanəsinə qayıdırdılar*. Ə.Məmmədxanlı.

**MALİKİYYƏT** *is.* [*ər.*] Malik olma, sahib olma; sahiblik, yiyəlik.

**MALİYYƏ** *is.* [*ər.*] 1. Dövlətə, yaxud ayrı-ayrı şəxslərə məxsus pul vəsaiti; pul. *Dövlət maliyyəsi.*

2. Pul işlərinin təşkili, pul dövriyyəsi və kreditlə bağlı olan. *Maliyyə nazirliyi. – Kosa, mühasibi çox axtardıqdan sonra onu maliyyə şöbəsi müdirinin kabinetində tapa bildi.* S.Rəhimov. // *dan.* Ümumiyyətlə, pul, pul işləri. *..Təhlükə zamanlarında Məşədi Kazım ağanın maliyyə işləri zərərdidə olurdu.* M.S.Ordubadi.

**MALİYYƏÇİ** *is.* 1. Maliyyə işləri mütəxəssisi.

2. *köhn.* Çoxlu pulu olan adam, dövlətli adam.

**MALİYYƏT** *is.* [*ər.*] *dan.* Dəyər, qiymət, baha. [Həsən:] *A başınıza dönüm,* [qoyunun] *maliyyəti dörd abbasıdır*. Ə.Haqverdiyev.

**MALİYYƏTSİZ** *sif. dan.* Heç bir dəyəri, qiyməti olmayan. *Maliyyətsiz şey.*

**MALKƏLƏMİ** *is. bot.* Mal yemi kimi istifadə olunan kələm növü.

**MAL-QARA** *top.* İri və xırda buynuzlu ev heyvanları. *Mal-qaramız artır. – Pəyədən mal-qaranı bəzi çıxardır qırağa; Bəzi səhraya gedir işləməyə, bəzi bağa.* A.Səhhət. *Nurəddinin mal-qaradan ancaq bir atı vardı.* S.S.Axundov. [Cavad:] *O ağacın yerində ev tikərik, çəpəri buradan çəkərik ki, mal-qara, dana həyətə girməsin*. B.Talıblı.

**MAL-QARAÇI** b a x **maldar**.

**MAL-QARAÇILIQ** *is.* Mal-qara saxlama; maldarlıq.

**MAL-QARALI** *sif.* Mal-qarası olan, mal-qara saxlayan. *Mal-qaralı həyət. – Qayib kişinin əvvəli mal-qaralı, qoyun sürülü, dövlətli bir kəndli idi.* S.S.Axundov.

**MALLI**[1] *sif.* Mal-qarası olan, mal-qaralı, ev heyvanı saxlayan. *Mallı kəndli.*

**MALLI**[2] *sif.* Varlı, dövlətli. *Eyləyirsən məni müşkül işə vadar, yazım? Mallı, pullu kişini zalimü qəddar yazım?* Ə.Nəzmi. *..Bir mallı, dövlətli kəndlinin cavan oğlu şiddətli surətdə dəli olur.* S.S.Axundov.

**MAL-MADAR, MAL-MÜLK** *is. dan.* Var, dövlət. *Mal-madar sahibi. Mal-madarı əlindən getmək.* – [Paşa bəy:] *Bu qədər cah-calal, ad-san, şan-şöhrət, mal-mülk əldən çıxsa dözmək olarmı?* Ə.Vəliyev.

**MALORUSLAR** *cəm* Ukraynalıların köhnə adı.

**MALPƏRƏST** *sif.* və *is.* [*ər.* mal və *fars.* ...pərəst] Var-dövlətə, pula, vara həris olan, onlara pərəstiş edən; malcanlı. *Malpərəst adam. Malpərəstin biridir.*

**MALPƏRƏSTLİK** *is.* Malpərəstin xasiyyəti, vara-dövlətə həris olma, pərəstiş etmə.

**MAL-PUL** b a x **mal-dövlət**.

**MALSIZ**[1] *sif.* Heyvanı olmayan, ev heyvanı saxlamayan. *Malsız həyət.*

**MALSIZ**[2] *sif.* Varı-dövləti olmayan; yoxsul, kasıb. *Malsız adam.*

**MALTÓZA** *is.* [*ing.*] Səməni şəkəri, təbii disaxaridlərdən biri.

**MALTUSÇULUQ** *is.* İngilis burjua iqtisadçısı Maltusun, kapitalizm şəraitində zəhmətkeşlərin ağır vəziyyətini ictimai səbəblərlə deyil, əhalinin son dərəcə sürətli artımı ilə izah edən mürtəce nəzəriyyəsi.

**MALYARİYA** [*ital.*] Növbəli titrətmə-qızdırması olan yoluxucu xəstəlik; titrətmə-qızdırma. *Malyariyaya tutulmaq. Malyariya ilə mübarizə.* – [Aydın:] *Mən malyariya sahəsində işləmək istəyirəm.* H.Seyidbəyli.

**MALYARİYALI** *sif.* Malyariya xəstəliyinə tutulmuş; titrətmə-qızdırmalı.

**MALYEMƏZ** *is.* Öz zəruri ehtiyaclarına belə pul xərcləməyən, imkanı, varı-dövləti olduğu halda korluqla yaşayan xəsis adam. *Malyeməzin malını yeyərlər.* (Ata. sözü). [Qoca:] *Oğlum, sən nə bildin ki, ölən malyeməz imiş?* "Əsli və Kərəm". [Qulu:] *Yəni belə malyeməzin malını yemək haramdır?* S.S.Axundov.

**MAMA**[1] *is.* Doğuş zamanı kömək göstərməklə məşğul olan (keçmişdə təhsilsiz, indi isə xüsusi təhsil görmüş) qadın. *Mama çox olanda, uşaq tərs gələr.* (Ata. sözü). [Cahan:] *Kənddə mama yoxluğu hiss edilirdi*. Ə.Haqverdiyev.

**MAMA**[2] 1. *məh.* b a x **bibi**.

2. *dan.* Ana. *Maması: – Əliş, burada niyə mürgüləyirsən?* Ə.Vəliyev.

**MAMAÇA** *is.* Xüsusi təhsili olmayan mama, ara həkimi. *Yüz mamaça yığılsa da, güc doğana düşər.* (Ata. sözü). *Səhərisi yenə mamaça gələr, zahıya baxıb lazımi tapşırıq və dərmanlar verər, şişi-zadı yığıb evdən tullardı.* H.Sarabski.

**MAMAÇALIQ** *is.* Mamaçanın sənəti, peşəsi, işi.

**MAMALIQ** *is.* Mamanın işi, peşəsi (b a x **mama¹**). *Nənəcan mamalıq edib qızını saxlardı.* N.Nərimanov. [Ziba] *özü də mamalıq texnikumunun son sinfində oxuyurdu.* S.Hüseyn.

**MAMIR** *is. bot.* Ali sporlu bitkilərdən ibtidai quruluşa malik bitki. *Həyatin hündür hasarları rütubətdən mamırla örtülmüşdü.* H.Seyidbəyli. *Cığırı çox yerdə yaşıl mamır basmışdı.* B.Bayramov.

**MAMIRLANMA** "Mamırlanmaq"dan *f.is.*

**MAMIRLANMAQ** *f.* Mamırla örtülmək, üzərində mamır bitmək. *Qaya mamırlanmışdı.*

**MAMIRLI** *sif.* 1. Mamırla örtülmüş, üstünü mamır basmış. *Dolaşdım Gürcüstanın; Mamırlı dağlarında.* Ə.Cavad. [Həkim] *..su içindəki mamırlı qayanın üstü ilə iməkləyərək qırağa çıxdı.* M.Hüseyn.

2. *məc. dan.* Tük basmış, qıllanmış. *Mehmanın axırıncı nəzəri mamırlı adamla toqquşdu..* S.Rəhimov.

**MAMIRLIQ** *is.* Çox mamır bitən yer, mamır basmış sahə.

**MAMIROTU** *is. bot.* Qərənfilçiçəklilər fəsiləsindən xırda çiçəkli ot bitkisi.

**MÁMONT** [*rus.*] Xarici görünüşcə fili xatırladan, buzlaşma dövründə yaşamış, uzuntüklü, yuxarı əyilmiş dişləri olan çox iri heyvan.

**MAN** *is. dan.* Eyib, nöqsan, kəsir. □ **Man deyil** – eyib deyil, nöqsan sayılmır. *Kasıblıq man deyil. – Arvad alıb-boşamaq zəmanəmizdə man deyil və ən asan işlərin birisidir.* E.Sultanov. *Amerikada bu adətdir; Oğru olmaq man deyildir.* R.Rza. □ **Man etmək (eyləmək)** – eyib tutmaq; eyibləmək; nöqsan bilmək. *Sinə açıq, zülf pərişan, üz yara; Məni belə görən sənə man eylər.* Aşıq Bəyim. **Man tutmaq (bilmək, görmək)** – b a x **man etmək (eyləmək)**. [Allahqulu:] *Çimnaz xala, .. qələt eləmişəm, sən atanın goru, man görmə!* Ə.Əbülhəsən.

**MANAT** *is.* Azərbaycanda yüz qəpiyə bərabər olan əsas pul vahidi. // Bu dəyərdə olan kağız və ya metal pul. *Hər biri mərdlik edib isbat; Dəftərə yazdı: verrəm əlli manat.* S.Ə.Şirvani. *Sitarə çıxarıb Aslana beş manat verdi.* S.Rəhimov.

**MANATLIQ** *is.* 1. Bir manat qiymətində olan pul. *Manatlığı xırdalamaq.*

2. Saylarla işlənib bir şeyin neçə manat dəyərində olduğunu bildirir. *5 manatlıq ağ almaq.* – [Kərbəlayı Cəfər:] *..Sən bir elə adam tap ki, mənə yeddi manat versin, mən onun yanında on yeddi manatlıq şey girov qoyum..* C.Məmmədquluzadə. [Gileygüzarov:] *Gətirdiyin üç manatlıq kitab hədiyyəsi nəyimə gərəkdir.* S.Rüstəm.

**MANCANAQ** *is.* [*yun.*] 1. Quyudan su çəkmək üçün ling rolunu oynayan uzun ağac. *Mancanaqla su çəkmək.* // *tex.* Quyudan nefti və ya suyu çıxartmaq üçün qurğu. *Mancanaq dəzgahı. – Mancanaqlar enib-qalxır, .. kompressor stansiyasından gələn yeknəsəq guppultunun arası kəsilmirdi.* M.Hüseyn. [Nefti] *quyudan mancanaqla çıxarırdılar.* S.Vəliyev.

2. Qədim müharibələrdə qalaların divarlarını dağıtmaqdan ötrü daş, yanar maye ilə dolu çəllək və s. atmaq üçün işlədilən mühasirə maşını. *Ərisək və mancanaq daşıyan arabalar Qarabağın aşılmaz gədiklərindən igidlərin çiynində çıxarılırdı.* M.S.Ordubadi.

**MANCANAQÇI** *is.* Qədimdə mancanağı (2-ci mənada) idarə edən döyüşçü. [Xan:] *Bir dəstə oxatan, bir dəstə mancanaqçı göndərsinlər.* "M.N.lətif."

**MANDAL** *is. məh.* Cəftə, siyirtmə. *Dəmir qapıların sanballı qıfılları zırınqıltı ilə açıldı, ağır mandallar cəftələrdən çıxarıldı.* Çəmənzəminli.

**MANDALLI** *sif. məh.* Cəftəli, siyirtməli. *Mandallı qapı.* // Dalına kilid (2-ci mənada) vurulmuş.

**MANDARİN¹** [*isp.*] b a x **naringi**.

**MANDARİN²** [*port.*] Köhnə feodal Çində dövlət məmurları.

**MANDÁT** [*lat.* mandatum – tapşırıq] 1. Təqdim edənin bu və ya digər vəkalətini təsdiq edən sənəd. *Deputat mandatı.*

2. 1914-1918-ci illərdəki dünya müharibəsində qalib ölkələrə, Almaniyanın keçmiş müstəmləkələrini və Osmanlı imperiyasının bir hissəsini idarə etmək üçün Millətlər Cəmiyyəti tərəfindən verilən hüquq.

**MANDATLI** *sif.* Mandatı olan. *Mandatlı nümayəndə.*

**MANDOLİNA** [*ital.*] Çanağı əsasən oval şəkilli mizrabla çalınan, dörd cüt simi olan musiqi aləti.

**MANDOLİNAÇI** *is.* Mandolina çalan çalğıçı.

**MANE** [*ər.*]: **mane olmaq** – əngəl olmaq, qarşısını almaq, bir işin icra olunmamasına səbəb olmaq. *Şaban arvadını, uşağını görən tək qollarını açıb istədi balasını bağrına bassın, amma soldat mane olub daldan bir tüfəng dürtməsi vurdu.* Ə.Haqverdiyev. [Müdir:] *Niyə xalqa mane olursan ki..* H.Nəzərli.

**MANEÇİLİK** b a x **maneə**. *Rüstəm öz ağlı ilə bilirdi ki, başqa bir maneçilik olmasa, Qəhrəman öz beynilə bu zəmanədə özünə düz yol seçə bilər..* S.Rəhimov. ☐ **Maneçilik törətmək** – mane olmaq, əngəl olmaq. *Həsrət Yusifə söz verdi ki, əgər Hümmət yenə maneçilik törətsə, o, raykomun üzvü kimi bu məsələni raykomda qoyacaqdır.* B.Bayramov.

**MANEƏ** *is.* [*ər.*] Bir işin görülməsinə, başa gəlməsinə yol verməyən, imkan verməyən şey, səbəb, əngəl; çətinlik. *Maneələri aradan qaldırmaq.* – [Mələk Şeydaya:] *Bundan sonra heç bir maneə, heç bir qüvvət sizi bir-birinizdən ayırmaz.* H.Cavid. [Həsən bəy:] *Mirzə Fətəli Axundzadə nə cür maneələrlə üz-üzə gəldi, ancaq mərd iradəsi hər şeyi yıxıb keçirdi.* Q.İlkin.

**MANEƏLİ** *sif.* Maneəsi olan; əngəlli, çətin.

**MANEƏSİZ** *sif.* və *zərf* Maneəsi olmayan, əngəlsiz, çətin olmayan, asan(lıqla). *Maneəsiz qapıdan içəri keçdi.*

**MANÉJ** [*fr.*] 1. At sürmək və at təlimi üçün xüsusi böyük bina və ya meydança. *Manejdə at təlimi.*

2. Sirk səhnəsi. *Maneji çıxış üçün hazırlamaq.*

**MANEKÉN** *is.* [*fr.*] Mağaza və atelyelərdə paltar nümayiş etdirmək üçün insan formasında düzəldilən fiqur; müqəvva.

**MANÉVR** [*fr.*] 1. *hərb.* Düşmənə zərbə endirmək məqsədilə qoşunların və ya donanmanın bir yerdən başqa yerə hərəkəti və bir yerə toplanması. *Toplar öz atəşləri və çarxlarilə durmadan manevr edirdilər.* Ə.Məmmədxanlı. // Ordu və ya donanmanın döyüş şəraitinə yaxın bir şəraitdə keçirilən taktiki təlimi. *Hələ Tbilisidə ikən Mədətov manevrdə qıçı burxulduğu üçün bir hospitalda on gün yatmışdı.* Ə.Əbülhəsən.

2. *d.y.* Qatar tərtib etmək üçün lokomotiv və vaqonların stansiya yollarında o tərəf-bu tərəfə hərəkəti. *Limanda duran paroxodların, manevr edən parovozların arabir fit səsi gəlirdi.* M.S.Ordubadi. *Qarşıdakı küçədə manevr edən parovoz arabir kəsik-kəsik fit verir.* H.Seyidbəyli.

3. İstiqaməti dəyişmə (gəmi, təyyarə haqqında). *Müstəqil naviqasiya ölçülərinin məlumatına görə gəmilərin komandirləri əl ilə idarədən istifadə etməklə qarşılıqlı surətdə manevri davam etdirirlər.*

4. *məc.* Biclik, hiylə, fırıldaq, fənd. [Knyaz:] *Sanırım bir manevr olmalı bu.* H.Cavid. *Ancaq bütün bunlar bir manevr idi.* S.Rəhman.

**MANİ** *is.* Türk xalq şeri və nəğmə janrı.

**MANİFÉST** [*lat.* manifestare – aydın, aşkar etmək] 1. Müstəsna əhəmiyyəti olan bir hadisə münasibətilə ali hakimiyyət orqanının əhaliyə yazılı müraciəti. *Kəndlilərin azad edilməsi haqqında manifest.* – *Qayda belədir: həmişə manifest çıxanda, ruznamələr onun məzmununu və mənasını camaata bildirirlər ki, hər bir kəs baxəbər olsun.* C.Məmmədquluzadə.

2. Siyasi partiyanın, ictimai təşkilatın proqram səciyyəli müraciəti. *Sülh haqqında manifest.*

3. Hər hansı bir ədəbi və ya bədii yaradıcılıq qrupunun öz yaradıcılıq prinsipləri haqqında yazılı şərhi. *Futuristlərin manifesti.* – "*Şair, Şeir pərisi və Şəhərli*" *poeması ilə Səhhət öz ədəbi manifestini elan etmişdi, dövrün kəskin, mürəkkəb ədəbi mübarizələrində öz mövqeyini bildirmişdi.* K.Talıbzadə.

**MANİKÜR** [*fr.*] Əl dırnaqlarının təmizlənməsi və parıldadılması. *Dırnaqlarını manikür etdirmək.*

**MANİKÜRÇÜ** *is.* Manikür mütəxəssisi olan qadın.

**MANİKÜRLÜ** *sif.* Manikür edilmiş, manikürü olan. *Dırnaqları manikürlü, dodaqları qırmızı; Kəlməbaşı deyir ki,* "*mən el qızıyam, el qızı*". S.Rüstəm.

**MANİPULYÁSİYA** *is.* [*fr.*] 1. Əlin və ya hər iki əlin müəyyən bir işlə bağlı hərəkəti; əl işində dəqiqlik tələb olunan əməliyyat.

2. Fırıldaq, kələk, hiylə.

**MANİVELA** [*ital.*] 1. *xüs*. İstinad nöqtəsi ətrafında fırlana bilən və kiçik qüvvə vasitəsilə böyük qüvvəni tarazlaşdırmaq üçün istifadə edilən mil, qol. // Bu prinsip əsasında düzəldilmiş tənzimedici mexanizm cihaz.

2. *məc*. Fəaliyyət doğuran, hərəkətə gətirən vasitə.

**MANJÉT** [*fr.*] 1. Paltarın qoluna qoyulan və ya onun özündən qatlanmış hissə; qolağzı. [Musanın nəvəsi] *qolunu bir az yuxarı sıyırdı ki, manjetinin düymələri parıldasın və qolundakı saat görünsün.* Qantəmir.

2. *tex.* Porşenli nasoslarda mayenin və ya qazın sızmasının qarşısını almaq və boruların başlarını bir-birinə bənd etmək üçün halqa. *Nasosun manjetini dəyişmək. Borunun manjetini bərkitmək.*

**MANJETLİ** *sif.* 1. Manjeti olan, manjet qoyulmuş, manjet tikilmiş. *Manjetli köynək.*

2. *tex.* Manjeti olan, manjet keçirilmiş, manjet salınmış. *Manjetli nasos. Manjetli boru.*

**MANQA** *is.* Hər hansı bir birləşmədə ən kiçik təşkilat vahidi. *Manqa komandaları baş komandanların tövsiyələrinə görə bütün nəfərlərə istiqamət göstərirlər.* H.Nəzərli. *Mürsəlov, Bəstiyə qoçaq qızlardan bir manqa düzəltməyi məsləhət gördü.* Ə.Sadıq.

**MANQABAŞÇI** b a x **manqabaşçısı**.

**MANQABAŞÇILIQ** *is.* Manqabaşçısının vəzifəsi, işi; manqaya başçılıq etmə. [Məmməd kişi] *qocalara Abbasın qohumbazlıq edərək öz gəlinlərini manqabaşçılığa irəli sürməsindən danışır və gileylənirdi.* Ə.Sadıq.

**MANQABAŞÇISI** *is.* Manqaya rəhbərlik edən adam; manqabaşı, manqabaşçı. *Səkinə istehsalat qabaqcılı kimi ad qazanaraq manqabaşçısı olmuşdu.* M.İbrahimov. [Firuzə] *hər işdə, hətta geyim və rəftarında belə öz manqabaşçısına oxşamağa çalışırdı.* İ.Əfəndiyev.

**MANQABAŞI** b a x **manqabaşçısı**.

**MANQABAŞILIQ** b a x **manqabaşçılıq**.

**MANQAL** *is.* [*ər.*] İçində od qalamaq üçün dəmirdən, misdən və ya gildən düzəldilmiş müxtəlif biçimli qab. *Manqalda kömür qızartmaq. – Yetər üzünü bürüyüb oturmuşdu və evin dalında Şaqqulu manqalın üstə kabab bişirirdi.* Çəmənzəminli. *Döşəmədə balaca bir manqal dururdu.* M.Hüseyn.

**MANQÁN** [*alm.*] *kim*. Çətin əriyən, kövrək, gümüşü-ağ rəngli kimyəvi maddə.

**MANQIR** *is.* Xırda pul.

**MÁNQO** [*malay.*] Sarı-yaşıl rəngli ətirli şirin meyvəsi olan tropik ağac və bu ağacın meyvəsi.

**MANQURT** [*xüs. is.*-dən] 1. Düşünmək qabiliyyətini itirmiş adam.

2. *sif.* Əsil-nəslini unutmuş. *Manqurtların buz kibi gözlərində qan, hədə; Toqquşuruq nə vaxtdır; O, dəmirdi, mən almaz.* X.Rza.

**MANÓMETR** [*yun.* monos metreo] *fiz.* Qapalı mühitdə qaz və mayelərin təzyiqini ölçən cihaz. *Civə manometri. – Zəki .. quyudakı sıxılmış havanın təzyiqini göstərən manometrə baxdı.* M.Süleymanov.

**MANSÁRDA** *is.* [*fr.*] Binaların üstündə çatı tavanlı otaq.

**MANSIRA** *is.* [*ər.*] *dan.* Əhatə, mühasirə.

**MANŞIRLAMAQ** *f. məh.* Bir şeyin yerini, səmtini və başqa cəhətlərini bələdləmək, nişanlamaq. *Bahadır bir ağacın dalına qısılıb məzkur qızı yaxşı manşırladı.* N.Nərimanov. [Xəlil:] *İndidən yerini manşırlasan yaxşıdır.* M.Hüseyn.

**MANTÁR** b a x **probka** 1-ci mənada. *Şüşənin mantarını açmaq. – Sözlər* [Səməndərin] *boğazında mantartək tıxanıb qalmışdı.* B.Bayramov.

**MANTİLYA** *is.* [*isp.*] 1. İspan qadınlarının ağ və ya qara tor örpəyi.

2. Qolsuz qısa qadın bürüncəyi.

**MÁNTİYA** [*yun.*] Ayağın üzünə qədər olan gen, uzun, plaşaoxşar geyim.

**MANTÓ** [*fr.*] Adətən xəzdən tikilən gen qadın paltosu. *Nazik ipək mantosunu çıxardıqda xidmətçi qız alıb paltar şkafından asdı.* M.S.Ordubadi.

**MANUFAKTÚRA** [*lat.*] 1. Tarixən iri maşın sənayesindən əvvəl olmuş kapitalist istehsal forması (manufakturanın səciyyəvi xüsusiyyətləri fəhlələrin əməyinin kapitalistin rəhbərliyi altında emalatxanada birləşdirilməsindən, istehsalatda əl zəhmətinin əsas yer tutmasından, emalatxana daxilində ciddi əmək bölgüsünün olmasından ibarət idi).

2. *köhn.* Fabrik (əsasən toxuculuq fabriki) və toxuculuq sənayesi məmulatı; parça.

**MANUFAKTURAÇI** *is. köhn.* Manufaktura mağazası sahibi; bəzzaz.

**MANÚL** *is. zool.* Çöl pişiyi.

**MARAFÓN** [*xüs. is.*-dən]: **Marafon qaçışı** *idm.* – 42 km 195 m məsafəyə qaçmaqdan ibarət yarış.

**MARAFONÇU** *is. idm.* Marafon qaçışında ixtisaslaşmış idmançı.

**MARAQ** *is.* 1. Bir şeyə diqqət, bir şeyi bilmək, öyrənmək həvəsi, meyli, arzusu. *Hələ Novruza və çərşənbələrə hazırlanmaq daha da böyük bir maraq təşkil edərdi.* Çəmənzəminli. *Bibixanımın üzündə bir maraq ifadəsi gəzdi.* B.Bayramov. □ **Maraq etmək (eləmək)** – 1) b a x **maraqlanmaq**; 2) təşviş etmək, narahat olmaq, düşünmək. *Saraya girdisə o, etmə maraq; Var səbəb, fitnə-fəsad ondan iraq.* A.Şaiq. **Maraq göstərmək** – həvəs göstərmək, maraqlanmaq. *Şirmayı böyüklərin söhbətinə qulaq asmağa sonsuz bir maraq göstərirdi.* M.Hüseyn. **Maraq oyatmaq (doğurmaq)** – həvəs oyatmaq, maraqlandırmaq. *Məndə uşaqlıqdan folklora maraq oyadan Yusif əmi olmuşdur.* A.Şaiq. **Maraqdan düşmək** – həvəsi qaçmaq, həvəsi getmək, daha maraqlanmamaq. *Keçər aylar, keçər illər, yaz, ey Vaqif, ömür azdır; Düşər bir gün laçın könlüm şeir, sənət marağından.* S.Vurğun.

2. **Maraqla** şəklində *zərf* – maraqlanaraq, həvəs göstərərək, böyük həvəslə, şövqlə. *Maraqla oxumaq. Maraqla baxmaq. Maraqla qulaq asmaq. – Tofiqlə bərabər quşlara maraqla tamaşa etməyə başladılar.* M.Rzaquluzadə. *Yoldan keçənlər heyrət və maraqla* [Dürrəyə] *baxırdılar.* S.Vəliyev.

**MARAQLANDIRMA** "Maraqlandırmaq"-dan *f.is.*

**MARAQLANDIRMAQ** *f.* Bir şeyə maraq, həvəs, diqqət oyandırmaq; şövqləndirmək, həvəsləndirmək. *Uşağı musiqiyə maraqlandırmaq. – Bu hadisə Mehribanı maraqlandırmağa başladı: Zeynal harada idi?* S.Hüseyn. *Əhməd kişi adlı bir qocanın həyatə daşınması kirəçiləri çox maraqlandırmışdı.* Çəmənzəminli.

**MARAQLANMA** "Maraqlanmaq"dan *f.is.*

**MARAQLANMAQ** *f.* Bir şeyə maraq göstərmək, bir şeyi bilməyə, öyrənməyə böyük həvəs və diqqət göstərmək. *İdmanla maraqlanmaq. – Mən bu qadının xüsusiyyətini öyrənməyə çalışdıqca onunla maraqlandım.* S.Hüseyn. [Rəşid:] *Əlbəttə, mən bunun səbəbi ilə maraqlanırdım.* İ.Hüseynov.

**MARAQLI** *sif.* 1. Maraq oyadan, marağa səbəb olan. *Maraqlı söhbət. Maraqlı xəbər. Maraqlı kitab. Maraqlı tamaşa. – ..Axırda da Tamam maraqlı nağıllarını başlardı.* S.S.Axundov. *Ancaq bugünkü idman bayramının xüsusi və maraqlı bir hissəsi də vardı.* M.Rzaquluzadə. // Zərf mənasında. *Maraqlı danışmaq. Maraqlı qulaq asmaq.*

2. Maraq ifadə edən. *Ucaboylular balacaların çiyninin üstündən baxır, balacalar ucaların böyründən başını çıxararaq maraqlı gözlərlə maşından düşənləri seyr edirdilər.* M.İbrahimov. // *İs. mənasında.* Maraqlanan, marağı, həvəsi olan adam; həvəskar. *Məhsəti xanımı görmək .. üçün şəhərin bütün şeir və musiqi maraqlıları Xərabət məhəlləsinin tininə yığışmışdılar.* M.S.Ordubadi. *Bəzi maraqlılar və qoyub gəldiyi ev-eşiyi, mal-dövləti üçün qorxanlar izdihamdan aralanıb .. sürətini artırırdı.* Ə.Əbülhəsən.

**MARAQLILIQ** *is.* Maraqlı olma, maraq doğuran şeyin xüsusiyyəti.

**MARAQSIZ** *sif.* 1. Marağı, həvəsi olmayan, maraq göstərməyən, həvəssiz, diqqətsiz. *Maraqsız adam.*

2. Maraq doğurmayan, zövq və həvəs oyandırmayan; sönük. *Maraqsız kitab. Maraqsız* (z.) *danışmaq. Maraqsız tamaşa.*

**MARAQSIZLIQ** *is.* Maraqsız olma, maraqsız şeyin xüsusiyyəti.

**MARAL** *is. zool.* Buynuzları budaq kimi şaxələnən, gövşəyən haçadırnaqlı heyvan. *Şimal maralı. Xallı maral. – Sürü üstündə çobanlar yatmaz qorxumdan; Çöldə heyvan, ya maral vaz atamaz qorxumdan.* A.Səhhət. // Təşbehlərdə "gözəl" mənasında. *Ovçusu olmuşam səntək maralın; Xəyalımdan çıxmaz hərgiz xəyalın.* M.P.Vaqif. [Əsgər:] *Gəl, gəl, maralım, gəl; Gəl, gəl, ceyranım, gəl!* Ü.Hacıbəyov.

**MARALBAXIŞLI** *sif. şair.* İri, süzgün və qəşəng gözlü. *Maralbaxışlı qız.* – [Turxan

bəy:] *Gerçəkdən maral deyil, adətən maral-baxışlı bir mələk!* H.Cavid.

**MARALÇI** *is.* Maral saxlayan, marala xidmət edən adam.

**MARALÇILIQ** *is.* Bir təsərrüfat sahəsi kimi maralyetişdirmə işi.

**MARALFINDIĞI** *is.* Azərbaycanda bitən fındıq növlərindən biri. *Qiymətli cinslərdən biri fındıqdır. Azərbaycanda üç növü bitir: meşəfındığı, ayıfındığı və maralfındığı..* M.Qasımov.

**MARALYONCASI** *is. bot.* Şimal marallarının əsas yemi olan ağ-boz rəngli kolşəkilli şibyə.

**MARÁZM** *is.* [*yun.*] 1. Beyin qabığının ümumi üzgünlüklə müşayiət olunan atrofiyası və psixi fəaliyyətinin dayanması.

2. *məc.* Mənəvi gücsüzlük. *Marazmın ilkin əlamətləri.*

**MARÇ** *təql.* Dodaqların sorucu hərəkətilə çıxarılan səciyyəvi səs.

**MARÇAMARÇ, MARÇAMARÇLA** *zərf* Març səsi çıxardaraq, marçıldadaraq. *Bu mükalimədən sonra Azad bəy oğlunu qucaqlayıb marçamarç ilə öpərdi. Uşaq da:* "*Əşi burax!*" *– deyib dartınardı ki, xilas olsun.* Ü.Hacıbəyov.

**MARÇILDAMA** "Marçıldamaq"dan *f.is.*

**MARÇILDAMAQ** *f.* Marçamarç səsi çıxartmaq, marçamarç etmək.

**MARÇILDATMA** "Marçıldatmaq"dan *f.is.*

**MARÇILDATMAQ** *f.* Dodaqları, ağzı ilə marçıltı səsi çıxartmaq, marçamarç etmək. [Kərbəlayı Cəfər] *çölməyin qapağını götürüb bir qaşıq ətin suyundan içdi və ağzını marçıldadıb, qaşqabağını turşudub üzünü tutdu Xudayar bəyə.* C.Məmmədquluzadə. *Tayqılça Kazım .. iştahasından ağzını marçıldadırdı.* Mir Cəlal.

**MARÇILTI** *is.* Dodaqların sorucu hərəkəti ilə çıxardılan marçamarç səsi. *Piri bud sümüyünü boşqaba tullayıb yağlı barmaqlarını marçıltı ilə yaladı.* İ.Məlikzadə.

**MARĞIZ** *is. k.t.* Tarlanın əkinə hazırlanmasında işlədilən kənd təsərrüfatı aləti.

**MARIQ** *is.* Pusqu. □ **Marığa durmaq** – pusquda durmaq, ovu güdmək, pusmaq. *Tağı əmi qırğının qayışını açdı. Bu halda Axtar sağ ayağını qaldıraraq marığa durdu.* S.S.Axundov. *Marığa duran cayıllar ağacların daldası ilə yeriyib Heydərin on addımlığına çatdılar.* S.Rəhimov. **Marığa yatmaq (sinmək)** – b a x **marığa durmaq**. *Tula marığa yatır.* – [Şahmar] *bir daşın dalına girib, ovçular demişkən, marığa yatdı.* B.Bayramov. // Marıq yeri, pusqu yeri. [Yaşar] *tüfəngini əvvəlki yerinə qoyub, marıqdan sağa, sahilə endi.* M.Rzaquluzadə.

◊ **Marıq vermək** – bitki suvaran zaman dayanan suyun qabağını açmaq, suyun səmtini dəyişmək.

**MARIQLAMA** "Marıqlamaq"dan *f.is.*

**MARIQLAMAQ** *f.* Marığa yatmaq, pusmaq, güdmək. *Ovu marıqlamaq.*

**MARIT** *is. dan.* Ov itlərinin ovu gördükdə aldıqları gərgin, hərəkətsiz vəziyyət. □ **Marıt vermək** – ovda pusmaq, güdmək, gözləmək. *Tula quşu tapıb marıt verməsə və vaxtında qaldırmasa, ən mahir ovçu da heç bir şey edə bilməz.* M.Rzaquluzadə.

**MARITLAMA** "Marıtlamaq"dan *f.is.*

**MARITLAMAQ** *f.* 1. Gözlərini bir yerə, bir nöqtəyə dikib baxmaq. *Yaxası açıq uşaq isə gah divardakı şəkillərə baxır, gah altdan-yuxarı danışanları marıtlayır.* Mir Cəlal.

2. B a x **marıqlamaq**. [İbrahim] *bir yerdə gizlənib başladı marıtlamağa.* (Nağıl). [Tofiq:] *..Divar dibindən marıtlamaqdan bir şey çıxmayacaq.* M.İbrahimov.

**MARITMA** "Marıtmaq"dan *f.is.*

**MARITMAQ** b a x **marıtlamaq**.

**MARİLƏR** *is.* Mari Muxtar Respublikasının əsas əhalisini təşkil edən xalq.

**MARÍMBA** *is.* Afrikada zərb musiqi aləti.

**MARÍNA** *is.* [*ital.*] Dəniz mənzərəsinin təsvirinə həsr olunmuş rəsm əsəri.

**MARİNAD** *is.* [*xüs. is.*-dən] Duza və sirkəyə qoyulmuş tərəvəz, şoraba, tutma.

**MARİNKA** *is. zool.* Çəkikimilər fəsiləsindən balıq cinsi.

**MARİONÉTKA** *is.* [*fr.*] 1. Kukla teatrı növü.

2. Başqası tərəfindən idarə olunan adam, təşkilat.

**MÁRKA[1]** [*alm.*] 1. Poçt, gerb və başqa rüsumların ödənildiyini bildirmək üçün üzərində müəyyən şəkil olan və qiyməti göstərilən kiçik kağız parçası. *Poçt markası.*

2. Mallarda, məmulatlarda hazırlanan yer, keyfiyyəti və s. göstərilən işarə, damğa. *Fabrik markası. Yeni polad markaları.*

3. Malın, məmulatın sortu, növü, tipi.

**MARKA**[2] Almaniyada, habelə Finlandiyada pul vahidi.

**MARKALAMA** "Markalamaq"dan *f.is.*

**MARKALAMAQ** *f.* Bir şeyin üzərinə marka yapışdırmaq, marka vurmaq. *Paketi markalamaq. Ayaqqabını markalamaq.*

**MARKALANMA** "Markalanmaq"dan *f.is.*

**MARKALANMAQ** *məch.* Üzərinə marka yapışdırılmaq, marka vurulmaq.

**MARKALI** *sif.* 1. Marka yapışdırılmış, markalanmış, markası olan. *Markalı paket. – Minlərlə məktub gəlir; Üstü çeşid-çeşid markalı.* R.Rza.

2. Üzərində fabrik və ya zavod markası (damğası) olan. *Balaca bir qutudan* [Səkinə] "*Zvezda*" *markalı qızıl saat və zümrüd qaşlı bir üzük çıxartdı.* M.İbrahimov. *..Bircə ay sonra* [Göyçək] *yeni markalı .. maşında gəzəcəkdi.* Ə.Əbülhəsən.

**MARKASIZ** *sif.* 1. Üzərində markası olmayan, marka yapışdırılmamış (məktub, sənəd və s.).

2. Üzərində fabrik və zavod markası olmayan. *Markasız mal.*

**MARKET** *is.* [*ing.*] Bazar.

**MÁRKETİNQ** *is.* [*ing.*] Bazar proseslərinin uçotu, bazarın təşkili, alış-veriş.

**MARKİZ** *is.* [*fr.* marquis] Fransada, İngiltərədə, İtaliyada və İspaniyada zadəgan rütbəsi, habelə belə rütbəsi olan şəxs.

**MARKİZET** [*fr.* marquisette] Çox nazik sapdan toxunan nazik pambıq və ya ipək şəffaf parça. *Beş metr markizet.* // Həmin parçadan tikilmiş. *Markizet paltar.*

**MARKSİST** *is.* Marksizm tərəfdarı. // Marksizmlə bağlı olan, marksizmə xas olan, marksizm prinsiplərini ifadə edən. *Marksist dialektika. Marksist dünyagörüşü.*

**MARKSİSTCƏSİNƏ** *zərf* Marksizm nöqteyi-nəzərindən (mövqeyindən), marksizmi əsas tutaraq. *Məsələyə marksistcəsinə yanaşmaq.*

**MARKSİST-LENİNÇİ** *sif.* Marksizmə-leninizmə aid olan, marksizm-leninizm prinsiplərini ifadə edən. *Marksist-leninçi partiya.*

**MARKSİZM** [K.Marksın adından] Təbiət və cəmiyyətin inkişaf qanunları, məzlum və istismar olunan kütlələrin inqilabı haqqında dünyagörüşü.

**MARKSİZM-LENİNİZM** *is.* Marks-Engels-Lenin nəzəriyyəsi.

**MARQARÍN** [*fr.*] Heyvan piyi, bitki yağları və bəzi başqa maddələrin qarışığından hazırlanan yağ.

**MARMELÁD** [*port.*] Meyvə püresi, patka və şəkərdən hazırlanan şirniyyat növü. *Alma marmeladı.*

**MAROKEN** *is.* [*xüs. is.*-dən] Kitab cildi üçün material; qumaş.

**MARONÍ** *is.* [*xüs. is.*-dən] Xristian icmalarından biri.

**MARS**[1] *is.* Nərd oyununda: oyunun axırına kimi bir daş da olsa çıxa bilməyib ikiqat uduzma. *Qayınata ilə kürəkən nərd oynayırdılar. Kərim .. marsa çalışırdı.* İ.Əfəndiyev. ☐ **Mars olmaq (qalmaq)** – nərd oyununda: bir daş da olsa çıxa bilməyib ikiqat uduzmaq. **Mars vermək (qoymaq, eləmək)** – nərd oyununda: qarşı tərəfə bir daş da olsa çıxmağa imkan verməyib ikiqat udmaq. [Qədimov:] [Kamandarov] *mənə bir-iki mars verib, qoy hələ bir onun borcundan çıxım, sonra oynarıq.* Ə.Əbülhəsən.

**MARS**[2] *is.* [*lat.*] Qədim romalıların mifologiyasında müharibə allahı.

**MARS**[3] *is.* Günəş sisteminin dördüncü planeti. *Ay kimi, Mars kimi, Venera kimi; Qəlbinin çox sirri kəşf olunmamış...* M.Araz.

**MARSELYÉZA** [*fr.* Marsel şəhərinin adından] Sonradan Fransanın milli himni olmuş fransız inqilabi mahnısı. *Marselyeza axır küçələrdə; Bəlkə bahar yelidir, axır?* R.Rza.

**MARŞ** [*fr.*] 1. Sırada bir qaydada, ritmik yürüş tərzi. *Təntənəli marş.*

2. Sırada bir qaydada, ritmik yeriməyə başlamaq üçün komanda. *Marş, irəli! Addımla, marş!*

3. Qoşunların yürüş qaydası ilə bir yerdən başqa yerə hərəkəti. *Üçgünlük marş.*

4. Addım taktına uyğun ölçüsü olan gümrah, aydın ritmli musiqi əsəri. *Müsavatın ilk himni, ilk marşı, ilk bayrağı onun adı ilə bağlı olduğu kimi, ilk şəhidi, 37-də mehraba gətirdiyi ilk qurban da Əhməd Cavad olub.* Y.Qarayev.

**MÁRŞAL** [*fr.*] Bəzi ölkələrin ordularında yüksək hərbi ad və ya rütbə, habelə belə adı və ya rütbəni daşıyan adam. *Səlim xansa*

*güvənib uca, kəskin dağlara; Nişan aldı marşalın dəli məğrur başını..* A.İldırım.

**MARŞALLIQ** *is.* Marşal rütbəsi, adı.

**MARŞRUT** [*alm.*] Adamların, ordunun, nəqliyyatın və s.-nin dayanacaq yeri göstərilməklə, qabaqcadan müəyyən olunmuş yolu. *Bakı-Moskva marşrutu.*

**MART** [*lat.*] Təqvim ilinin üçüncü ayı. *Mart qırğınları. – Mart çıxdı, dərd çıxdı.* (Ata. sözü).

**MARTÉN** [*xüs. is.*-dən]: **marten peçi (sobası)** – polad əritmək üçün xüsusi quruluşlu soba.

**MARTENÇİ** *is. xüs.* Marten sobasında işləyən fəhlə.

**MARTI, MARTIQUŞU** *zool.* Qağayı. *Yeni doğan günəşin daşqın şəfəqlərində; Dənizdə martı kimi yuyunuram hər səhər.* A.Şaiq. *Rəngin şəfəqlərə boyanır Xəzər; Uçuşur martılar – o nazlı quşlar.* S.Vurğun. *..Bəzən də martı quşları qiyyə çəkib gah enir, gah da qalxırdılar.* H.Seyidbəyli.

**MARTİT** *is.* Mineral.

**MASA** *is.* [*rumıncadan*] Miz, stol. *Otağın küncündə bir dəyirmi masa görünürdü.* Çəmənzəminli. [Mehriban] *vaxtın gec olmasına baxmayaraq, küçə balkonuna bir masa çıxarıb süfrə düzəltdi.* S.Hüseyn. *Cəfər əmi əvvəlcə hazırladığı anketi masanın üzərinə qoydu.* H.Nəzərli.

**MASABƏYİ** *is.* Qonaqlığı, ziyafəti, məclisi idarə edən adam; tamada. *Gecənin dodaqları gülümsəyirdi; Masabəyi sevinclə: – İçin! – deyirdi.* M.Müşfiq. *Bir ağızdan hakimi; Masabəyi seçdilər.* B.Vahabzadə.

**MASABƏYİLİK** *is.* Masabəyinin işi, vəzifəsi; tamadalıq.

**MASÁJ** [*fr.*] Müalicə və ya kosmetik məqsədlə bədəni və ya onun bir yerini əllə sığallama, sürtmə, ovuşdurma. *Masaj etmək. Masajla müalicə.*

**MASAJÇI** *is.* Masaj edən tibb işçisi.

**MASAJLAMA** "Masajlamaq"dan *f.is.*

**MASAJLAMAQ** *f.* Masaj etmək.

**MASAJLANMA** "Masajlanmaq"dan *f.is.*

**MASAJLANMAQ** *məch.* Masaj edilmək.

**MASAL** *is.* Nağıl, hekayə. *Qışın oğlan zamanı; Ağca masal söylərsən.* Ə.Cavad. *Kim yanılıb deyir: ömür masaldır; Bir şirin uyqudur, bir boş xəyaldır?* M.Müşfiq.

**MASAÜSTÜ** *sif.* 1. Masanın üstünə salınmağa, qoyulmağa məxsus; stolüstü. *Masaüstü lampa.*

2. *məc.* Daim istifadə edilən, əl altında olan, çox lazım olan; stolüstü. *Masaüstü kitab.*

**MASƏVA** *qoş.* [*ər.*] *köhn.* Qeyri, başqa, əlavə, o birisi. *..Padşahın hüzurunda nədimlərdən masəva böyük möbid dəxi olurdu ki, cəmi ülumə xəbərdar idi.* M.F.Axundzadə. [Niyaz bəy:] *Ondan masəva bu oxuyub tərbiyə alanların nəzərləri külfətə ayrı, avamlarınkı ayrı.* N.Nərimanov.

**MASKÁ** [*fr.* əsli *ər.* məsxərə-dən] 1. Tanınmamaq üçün üzə taxılan və göz üçün deşikləri olan xüsusi örtük. *Maska taxmış pəhləvan. – Qəribə zamanda yaşadıq, oğul; Bilmədik maskayla üzün fərqini.* B.Vahabzadə. // Üzərində müxtəlif heyvan, quş, insan surətləri olan üz örtüyü. *Ayı maskası. Pişik maskası. – Bu zaman maskalar geymiş aktyorlar, mənfur çar məmurlarını, ruhaniləri, bəy və xanları .. təqlid edərək oyun çıxarıb adamları güldürürdülər.* S.S.Axundov.

2. İnsan və ya heyvan sifətini təsvir edən heykəltəraşlıq əsəri. // Ölmüş adamın üzünün gipslə çıxarılan surəti, qəlibi.

3. *xüs.* Üzü qorumaq üçün üzlük. *Qaynaqçı maskası. Qaz maskası.*

4. Üzü və ya onun bir hissəsini tutan xüsusi örtük. *Oksigen maskası. Cərrah maskası.*

5. Hərbi maskalama vasitəsi. *Top maskası.*

◊ **Maska geymək (qoymaq)** *məc.* – öz həqiqi simasını, mahiyyətini, iç-üzünü gizlətmək. **Maskasını atmaq** – öz niyyətlərini, mahiyyətini aşkara çıxarmaq. **Maskasını yırtmaq** – gizli niyyətlərini aşkara çıxarmaq, iç-üzünü açıb göstərmək. *Buna görə nə imarət, nə səltənət istəyirəm; Üzlülərin maskasını yırtmaq üçün səlahiyyət istəyirəm!* X.Rza.

**MASKALAMA** "Maskalamaq"dan *f.is.*

**MASKALAMAQ** *f.* 1. Bir adamın və ya bir şeyin üzünə maska taxmaq, maska keçirtmək.

2. Bir şeylə üstünü örtmək, gizlətmək; görünməz, ətraf mühitdən seçilməz hala salmaq. *Səngərləri maskalamaq. Topları maskalamaq.*

**MASKALANMA** "Maskalanmaq"dan *f.is.*

**MASKALANMAQ** *f.* 1. Maska taxılmaq, maska keçirilmək.

2. Bir şeylə üstü örtülmək, gizlədilmək; görünməz, seçilməz hala salınmaq. *Atəş nöqtələri maskalanmışdı.*

3. *qayıd.* Üzünə maska taxmaq, maska geymək.

4. *məc.* Özünü olduğu kimi deyil, başqa cür göstərmək, başqa cildə (dona) girmək, öz simasını gizlətmək, ikiüzlülük etmək.

**MASKALI** *sif.* Üzündə maska olan; maska taxmış, maska geymiş. *Maskalı uşaq.*

**MASKARÁD** [*fr.* mascarade, əsli *ər.* məsxərədən] İştirakçıları xüsusi maskalar taxmış və cürbəcür qəribə və fantastik, yaxud keçmiş dövrlərin paltarlarını geymiş halda keçirilən şənlik, ziyafət, bal. *Maskarad gecəsi. Maskarad paltarı.*

**MASKARÓN** *is.* [*fr.*] Pəncərə və qapı açırımlarında, fəvvarələrdə, həmçinin mebel, qab və s. bədii tərtibatında tətbiq olunan insan sifəti və ya heyvan başı şəklində maska və ya dekorativ relyef.

**MASKÓN** *is.* [*ing.*] Ay səthində yerləşib, kütlə sıxlığı böyük olan hissələr.

**MASQARA** *is.* [*ər.*] İstehza, ələ salma, dolama, rişxənd, gülmə. *Ancaq bəziləri masqara üçün sonralıqca vərdiş etdiklərindən* [Süleyman bəyə] "*Mirzə Süleyman bəy*" *deyirdilər.* B.Talıblı. [Şah İsmayıl] *yoldaşına kömək çıxaraq bir atalar sözünü kinayə ilə ortalığa atdı və masqara ilə hırıldadı..* Ə.Sadıq. ☐ **Masqara etmək** – istehza eləmək, ələ salmaq, araya qoymaq, dolamaq. *Məktəbin tələbələri Hüseynin .. iri ayaqqabılarına masqara edib gülürdülər.* S.Rəhimov. **Masqaraya qoymaq** – b a x **masqara etmək**. "*Molla Nəsrəddin*" *istixarəni masqaraya qoyub, va şəriəta!* C.Məmmədquluzadə. [Nazlı:] *Görürsənmi, Cabbar əmi də səni masqaraya qoyur.* Ə.Əbülhəsən.

**MASQARABAZ** *sif.* və *is.* [*ər.* məsxərə və *fars.* ...baz] Meydan teatrı aktyoru, təlxək, məzkərəçi, gülüş ustası. *Masqarabaz adam.*

**MASQARABAZLIQ** *is.* Masqara etmək xasiyyəti, masqara etmə; rişxəndçilik.

**MASQARAÇI** b a x **masqarabaz**. *Burada hər kəs .. eyni zamanda masqaraçı, oyunçu, məzhəkəçidir*. M.S.Ordubadi.

**MASQARAÇILIQ** b a x **masqarabazlıq**. *Bunlar da eyni məzhəkəçilik və eyni masqaraçılıqda iştirak edirdilər.* M.S.Ordubadi.

**MASQURA** *is.* [*fars.* mastxurə] Kiçik kasa, kiçik piyalə. *Masqurada bir az pendir, bir az doşab vardı.* C.Cabbarlı.

**MASON** *is.* [*fr.*] XVIII əsrin əvvəllərində Fransada yaranmış dini-etnik hərəkatın üzvü.

**MASSÍV** [*fr.*] 1. *coğr.* Geoloji quruluş cəhətdən bir cür olan yastı dağ təpələrindən ibarət sahə. *Tyan-şan massivi.*

2. Hər hansı əlamətlərinə görə bir cür olan geniş sahə. *Meşə massivi. Çöl massivi. – Eldar* [atın] *üstündə pambıq massivlərini gəzirdi.* Ə.Məmmədxanlı.

**MASTÍKA** [*yun.*] 1. Cürbəcür məqsədlər üçün işlədilən müxtəlif tərkibli qəliz maddə.

2. Döşəməyə sürtmək üçün tərkibində mum və boya olan maddə. *Döşəməni mastika ilə silmək.*

**MASTÍT** *is.* [*yun.*] *tib.* Döş vəzisinin iltihabı, döşgəlmə.

**MAŞ** *is. bot*. Lobya.

**MAŞA** *is.* Ocaqdan od və ya qızmar bir şeyi götürmək üçün metal alət. *Vaqif arabir buxarını maşa ilə qurdalayırdı.* Çəmənzəminli. *Rəhim bəy dodaqaltı gülümsədi, böyründəki maşanı götürüb manqalın közlərini qurdaladı.* M.Hüseyn.

**MAŞALAMA** "Maşalamaq"dan *f.is.*

**MAŞALAMAQ** *f.* Maşa ilə qurdalamaq. *Ocağı maşalamaq.*

**MAŞALLAH** [*ər.*] "Allah gözdən saxlasın", "afərin", "mərhəba" kimi mənalarda bəyənmə və tərif bildirir. [Mirzə:] *Dünən oğlunu gördüm, maşallah, yaxşı oğlana oxşayır*. Ə.Haqverdiyev. [Anası:] *Oğlum axırda oxuyub nəçərnik olacaq. Maşallah, indidən elə nəçərnik kimi də dolanır*. Qantəmir. // Bəzən istehza, kinayə məqamında işlənir. *Maşallah, gecə-gündüz valimiz; Çalır fartapiyan, oynayır bilyart.* Q.Zakir. *Maşallah, söz danışana! Götürüb qarpız qabığını şappıltı ilə vurasan .. danışanın ağzından, ağzını yumsun, getsin işinə.* C.Məmmədquluzadə.

**MAŞIN** [*fr.* əsli *lat.*] 1. Enerjini bir şəkildən başqa şəklə salmaq yolu ilə hər hansı bir faydalı iş görən mexanizm və ya mexanizmlər toplusu. *Hesablayıcı maşın. Çap maşını. Tikiş maşını.* ☐ **Yazı maşını** – mətni çap etmək üçün dillər üzərində hərflər olan mexanizm. *Vəkillər .. bu ərizələri və siyahıları*

*maşında səliqə ilə çap eləyib, gətirib qoymuşdular Sərdarın qabağına.* C.Məmmədquluzadə.

2. *məc.* Qeyri-iradi, mexaniki surətdə hərəkət edən adam haqqında. // *məc.* Mexanizm kimi fasiləsiz və dəqiq işləyən idarə, təşkilat və s. *Dövlət maşını.*

3. Hər hansı bir mexanizm vasitəsilə hərəkətə gətirilən nəqliyyat vasitəsi (əsasən avtomobil). *Maşına minmək. Yük maşını. Minik maşını. – Şofer .. təsadüfən oradan keçən başqa bir maşınla geri qayıtmışdı.* S.Hüseyn. // *köhn.* Dəmiryol qatarı. *Maşın saat 5-də yola düşür.*

**MAŞINÇI** *is.* 1. B a x **maşinist**.

2. Maşında işləyən fəhlə. *Gənc maşınçı, nasosu yağlayan yaşlı bir arvad və Şəfiqə dayanmış nasosu gözdən keçirirdilər.* H.Seyidbəyli.

**MAŞINÇILIQ** *is.* Maşınçının işi, sənəti; maşinistlik. [Gülüş Atakişiyə:] *Mən səni dəmir yolunda maşınçılıq kurslarına yazdıracağam, gedərsinizmi?* C.Cabbarlı.

**MAŞINXANA** *is.* [*lat.* machina və *fars.* ...xanə] Maşınların olduğu bina, maşınlar işləyən yer. *Mexaniki zor ilə maşınxanadan kənara çıxartdılar.* H.Nəzərli.

**MAŞINKA** [*rus.*] 1. B a x **pilətə**. *Rüstəm kişi .. maşınkanı yandırıb qazanı onun üstünə qoydu.* M.İbrahimov. *Kəramət ətə soğan qatıb, kotletlik hazırlamağa başladıqda, Qafar ayağa qalxdı, neft maşınkasını yandırdı.* Ə.Əbülhəsən.

2. B a x **makina** 1-ci mənada. *Hərdən .. qapının dalından küt maşınka çaqqıltısı eşidilirdi.* İ.Hüseynov.

**MAŞINQAYIRAN** *is.* 1. Maşınqayırma sənayesi işçisi.

2. B a x **maşınqayırma**.

**MAŞINQAYIRMA** *is.* Maşın emalı, maşın istehsalı. *Maşınqayırma zavodu. Maşınqayırma sənayesi.*

**MAŞINLAMA** "Maşınlamaq"dan *f.is.*

**MAŞINLAMAQ** *f.* 1. Tikiş maşınında tikmək. *Paltarı maşınlamaq*.

2. Maşınla qırxmaq. [Qarakişi:] *Gəldim ki, bir başımı maşınlayasan, ay Yusif!* B.Bayramov.

**MAŞINLANMA** "Maşınlanmaq"dan *f.is.*

**MAŞINLANMAQ** *məch.* 1. Tikiş maşınında tikilmək. *Köynək maşınlanıb.*

2. Maşınla qırxılmaq.

**MAŞINLAŞDIRILMA** "Maşınlaşdırılmaq"-dan *f.is.*

**MAŞINLAŞDIRILMAQ** *məch.* İstehsalata maşınlar, mexanizmlər tətbiq edilmək.

**MAŞINLAŞDIRMA** "Maşınlaşdırmaq"dan *f.is.*

**MAŞINLAŞDIRMAQ** *f.* İstehsalata maşınlar, mexanizmlər tətbiq etmək, istehsalatı mexanizmləşdirmək. *İstehsal proseslərini maşınlaşdırmaq.* – [Yaşar:] *Biz təsərrüfatı maşınlaşdırmaqla təbiətin əlində olan bütün sərvəti ancaq sinifsiz cəmiyyətin ixtiyarına verməliyik.* C.Cabbarlı.

**MAŞINLAŞMA** "Maşınlaşmaq"dan *f.is.*

**MAŞINLAŞMAQ** *f.* Maşınlarla, mexanizmlərlə təchiz olunmaq, istehsalata maşın tətbiq olunmaq. *Azərbaycan kəndləri sürətlə maşınlaşır.* İ.Əfəndiyev.

**MAŞINLATDIRMA** "Maşınlatdırmaq"dan *f.is.*

**MAŞINLATDIRMAQ** *f.* 1. Tikiş maşınında tikdirmək. *Yorğanüzünü maşınlatdırmaq.*

2. Maşınla qırxdırmaq. [Adil:] [Atam] *saçını dibindən maşınlatdırdığı üçün həmişəkindən arıq görünürdü.* B.Bayramov.

**MAŞINLI** *sif.* Maşını olan; maşınlar, mexanizmlər tətbiq edilən. *Maşınlı təsərrüfat.*

**MAŞINSÜRƏN** *is.* Maşını idarə edən işçi; sürücü.

**MAŞINŞÜNAS** *is.* [*lat.* machina və *fars.* ...şünas] Maşınşünaslıq mütəxəssisi.

**MAŞINŞÜNASLIQ** *is.* Maşın və mexanizmlərin təsviri və nəzəriyyəsi haqqında fənn. *Maşınşünaslıq kursu.*

**MAŞİNİST** [*lat.*] Maşını (parovozu, elektrovozu və s.) idarə edən işçi. *Baxın cavan maşinistə, nəğmə söyləyir; Hərəkətə gətirərək ilk parovozu.* S.Rüstəm. *Qatarları sürən maşinistlər hamısı Fərmanla tanışdır.* Ə.Sadıq.

**MAŞİNİSTKA** [*rus.*] b a x **makinaçı**.

**MAŞİNİSTLİK** *is.* Maşını idarəetmə işi, maşinistin işi, peşəsi, sənəti. [Dursun] *maşinistliyə, şoferliyə, montyorluğa da qızlardan şagird qoydu.* Ə.Əbülhəsən.

**MAT** *is.* [*fars.*] 1. Heyrət içində olan, təəccüblənmiş. *Mən bu işə matam.* ☐ **Mat etmək** – b a x **mat qoymaq**. *Yaşı on səkkizə*

*yenicə yetmiş; Gözəllikdə tamam xəlqi mat etmiş.* M.P.Vaqif. *Fəqirlərə yüz minlərlə ehsan edib, bütün şəhəri öz səxavət və mərhəmətinə mat etmişdi.* C.Cabbarlı. **Mat qalmaq** – təəccüblənmək, heyrət etmək, heyrətlənmək. *Bu işlərə mat qalmışam. – Ağca xanım .. divanın altına baxdı və Qaraca qızı orada görməyib mat qaldı.* S.S.Axundov. *Məclisdəkilər o qədər şiddətlə bu sözü alqışladılar ki, Cəfərqulu özü də mat qaldı.* Qantəmir. **Mat qoymaq** – heyrətləndirmək, təəccübləndirmək.

2. Şahmat oyununda: məğlubiyyət, məğlub olma. ☐ **Mat etmək** – məğlub etmək, udmaq, aparmaq. *Rəqibi mat etmək.* **Mat qalmaq** – uduzmaq, məğlub olmaq. **Mat qoymaq** – b a x **mat etmək**.

**MATADÓR** [*isp.*] İspaniyada və Latın Amerikasının bəzi ölkələrində: buğa döyüşündə buğaya qılıncla axırıncı, öldürücü zərbəni vuran baş döyüşçü, toreador. *Firəngiz lap gənclikdən matadorlara rəğbət bəslərdi.* B.Bayramov.

**MATAH** *is.* [*ər.* “mətə” sözünün canlı dildə işlənən forması] Qiymətli, aztapılan şey, əziz şey (adətən istehza məqamında işlənir). [Qasım kişi:] *Qadam onun qulaqlarına da, gözlərinə də, qaşlarına da, çox matah şeydi, hələ durub onu tutub qulaqlarını da .. axtaracağam ki, görüm haradadı.* C.Məmmədquluzadə. [Məhərrəmin anası:] *Apar matahını evində saxla, indi ki, çörəyimizə naşükürlük edir.* Mir Cəlal.

**MATAN** *sif.* və *is. dan.* Kök, ağ, göyçək, koppuş. *Matan bala. Matan qız.*

**MATARA** b a x **mətərə**.

**MATÇ** [*ing.*] Şahmat və ya idmanın bu və ya başqa növü üzrə iki rəqib, yaxud iki komanda arasında keçirilən yarış. *Şahmat matçı.* – [Dostum] *bu axşam şəhərdə futbol matçı olacağından oraya getməli idi.* M.Rzaquluzadə.

**MATDIM-MATDIM** *zərf*: **matdım-matdım baxmaq** – susmuş, sakit dayanmış halda gözlərini bir nöqtəyə zilləyib təəccüblə baxmaq. [Cəbi] *çox vaxt matdım-matdım bir nöqtəyə .. baxırdı.* N.Nərimanov. *Çox ağır nəfəs alıb inləyirdi dərindən; Matdım-matdım baxırdı, tərpənmirdi yerindən.* S.Rüstəm.

**MATERİAL** [*lat.*] 1. Bir şey qayırmaq, istehsal etmək, qurmaq üçün işlədilən cisim, şey, maddə, ləvazimat, xammal. *Tikinti materialı.* – [Direktor:] *Material var. Taxta-şalban göndəriblər.* M.Hüseyn. *Qum, çınqıl və başqa materiallar daşıyan onlarca yük avtomobillərinin alovlu gözləri parlayırdı.* Ə.Sadıq. ☐ **Sarğı materialı** – yaranı sarımaq üçün tənzif, bint, pambıq.

2. Hər hansı bir şey üçün əsas, sübut ola bilən məxəz, məlumat, vəsait. *Elmi tədqiqat materialları.* // Hər hansı bir işə, məsələyə dair sənədlər, kağızlar, yazılar. *Sübhanverdizadənin topladığı iki cild material Əbişin bağrını yarırdı.* S.Rəhimov.

3. Düşmənçilik, qərəzkarlıq məqsədilə verilən yazılı məlumat. *Səlim yüz cür böhtançı materiallarla Dilaranı məktəbdən .. qovdurdu.* M.İbrahimov.

**MATERİALBAZ** *is.* [*lat.* materialis və *fars.* ...baz] Başqası haqqında düşmənçilik, qərəzkarlıq məqsədilə material verməyi özünə peşə etmiş adam; donosçu.

**MATERİALBAZLIQ** *is.* Başqası haqqında düşmənçilik və qərəzkarlıq məqsədilə material vermə; donosbazlıq. *O, materialbazlıq, dedi-qodu, giley-güzar ilə də məşğul olmamışdı.* “Kirpi”.

**MATERİALİST** [*fr.*] Fəlsəfi materializm tərəfdarı.

**MATERİALİSTCƏSİNƏ** *zərf* Materializmə əsaslanaraq, materializm prinsipləri əsasında. *Təbiəti materialistcəsinə dərk etmək. Məsələyə materialistcəsinə yanaşmaq.*

**MATERİALİZM** [*fr.*] İdealizmin əksinə olaraq, şüura, təfəkkürə nisbətən materiyanın, təbiətin, obyektiv varlığın ilkinliyini, şüurdan, təfəkkürdən asılı olmayaraq, dünyanın obyektiv varlığını və onun qanunauyğunluqlarının dərk olunmasının mümkünlüyünü qəbul edən elmi-fəlsəfi cərəyan. ☐ **Dialektik materializm** – marksizm-leninizmin, dialektik metoda, təbiətin və cəmiyyətin ardıcıl materialistcəsinə başa düşülməsinə istinad edən fəlsəfi əsası. **Tarixi materializm** – cəmiyyətin inkişafının ən ümumi qanunları haqqında elm.

**MATERİALŞÜNAS** *is.* [*lat.* material və *fars.* ...şünas] Materialşünaslıq mütəxəssisi.

**MATERİALŞÜNASLIQ** *is.* İstehsalın hər hansı bir sahəsinə aid olan materiallar haqqında elm.

**MATERİK** [*lat.*] *coğr.* Hər tərəfdən dəniz və okeanlarla əhatə olunmuş ən böyük quru sahəsi; qitə.

**MATERİYA** [*lat.*] 1. *fəls.* İnsan şüurundan kənarda və ondan asılı olmayaraq mövcud olan obyektiv varlıq; maddə.

2. Təbiətin fiziki cisimlərini təşkil edən maddə. *Materiyanın quruluşu.*

3. *dan.* Parça, arşınmalı, material.

**MATƏM** *is.* [*ər.*] Yas, təziyə, əza. □ **Matəm geymək** *məc.* – matəm əlaməti olaraq qara geymək; yas saxlamaq, təziyə tutmaq. *Mən köçdüm dünyadan vaxtından qabaq; Ki, matəm geyməsin bu ana torpaq.* M.Rahim. **Matəm qopmaq** – ağlaşma başlamaq, yas qurulmaq. *Vəqta ki, qopur bir evdə matəm; Təşkil edilir büsati-ehsan.* M.Ə.Sabir. **Matəm qurulmaq** – yas məclisi qurulmaq. *..Danabaş kəndində üç yerdə matəm qurulubdu..* C.Məmmədquluzadə. **Matəm saxlamaq** – yas saxlamaq, yasa batmaq. *Minlərlə adam atom bombaları qurbanlarına matəm saxlayır.* // *məc.* Yas, kədər, hüzn. *Of, ana, Fitnəni görərsə Bəhram; Bizə matəm olar bu toy, bu bayram.* A.Şaiq. *İnsanlar öpüşüb qardaş olsalar; Dünyada nə matəm, nə məhbəs qalar.* S.Vurğun. □ **Matəm çəkmək** – yasa batmaq, kədərə qərq olmaq. *Hər yer viran, səssiz, sanki matəm çökmüş çöllərə.* A.Səhhət. **Matəmə batmaq** – kədər içərisində olmaq, yasa batmaq. [Dostəli:] *Şəhərin tamam yarısı matəmə batıb, amma siz burada şadlıq edirsiniz.* Ü.Hacıbəyov. *Hər gələn yurdumda bir at oynatdı; Analar gənc ikən matəmə batdı.* S.Vurğun. **Matəmə bürünmək** – bax **matəmə batmaq**. *Bürünüb matəmə kəndlər və şəhərlər ölüdür; Elə bil, orda həyətlər, küçələr qan gölüdür.* S.Rüstəm.

◊ **Matəminə oturum!** – qarğış məqamına işlənir.

**MATƏMƏNGİZ** *sif.* [*ər.* matəm və *fars.* ...əngiz] *klas.* Matəmi xatırladan, hüzn və kədər doğuran. *Gecənin üç payı keçmiş, mumlar, çıraqlar sönmüş, təbiəti matəməngiz bir zülmət bürümüşdü.* A.Şaiq.

**MATƏMGAH** *is.* [*ər.* matəm və *fars.* ...gah] *klas.* Matəm saxlanılan yer; yasxana.

**MATƏMXANA** *is.* [*ər.* matəm və *fars.* ...xanə] Matəm saxlanan ev, yaslı ev. *Kərbəlayı Kazımın matəmxanaya dönmüş evini beşlik bir neft çırağı işıqlandırırdı.* P.Makulu.

**MATƏMKƏDƏ** [*ər.* matəm və *fars.* ...kədə] *klas.* bax **matəmgah**. *Matəmkədə eylədi məqamın; Matəmdə keçirdi sübhü şamın.* Füzuli.

**MATƏMLİ** *sif.* 1. Yaslı. *Matəmli adam. – Göylər matəmlilər kimi qara çarşaba bürünmüş, dağlar, çöllər ağ kəfənlə örtülmüşdü.* A.Şaiq.

2. *məc.* Matəmi andıran; qəmli, kədərli, qüssəli, hüznlü. *Yanan şamlar otağa matəmli bir süs vermişdi.* Çəmənzəminli.

**MATƏMZƏDƏ** *sif.* [*ər.* matəm və *fars.* ...zədə] *klas.* Yaslı, matəmli, fəlakətzədə, fəlakət üz vermiş, fəlakətə uğramış. *Matəmzədə olduğun eşitdim; Qıldım yaxa çakü şivən etdim.* Füzuli.

**MATQAB** *is.* [*ər.*] Dəlici alət, burğu. *16-cı və 17-ci nömrələrin arasında olan taxta qapı matqab ilə iki yerdən deşilib gizlincə baxmaq üçün göz yerləri qayrılmışdı.* S.M.Qənizadə.

**MAT-QUT** *is.*: **matı-qutu qurumaq (çəkilmək)** – donub qalmaq, heyrət içində olmaq. *Qorxudan matı-qutu çəkildi. – Atanın matı-qutu qurudu. Oğluna nə cavab verəcəyini bilmədi.* Ə.Vəliyev.

**MAT-MAT** *zərf*: **mat-mat baxmaq** – donuxmuş halda sakit-sakit baxmaq, heyrətlə, təəccüblə baxmaq. *Balaca dörd yaşında Cəbi atasına mat-mat baxardı, bir söz də söyləməzdi.* N.Nərimanov. **Mat-mat gözlərini döymək** – bax **mat-mat baxmaq**. *Özünü itirən Şahmar mat-mat gözlərini döydü.* B.Bayramov.

**MAT-MƏBHUT** *zərf* [*ər.*] Heyrət içində, böht içində, çox təəccüblə. *Mat-məbhut durmaq. – Hamı mat-məbhut bir-birinə baxırdılar.* H.Nəzərli. [Dərviş:] *Mən mat-məbhut qaldım.* A.Divanbəyoğlu. *Kərim mat-məbhut oturub dərin fikrə getmişdi.* Ə.Vəliyev.

**MAT-MƏƏTTƏL** bax **mat-məbhut**. *Bəlli Əhməd mat-məəttəl dayanmışdı.* "Koroğlu". *Fatma bir müddət mat-məəttəl ətrafına baxır.* M.Dilbazi.

**MATRİARXAT** [*lat.* mater – ana və *yun.* arche – hakimiyyət] b a x **madərşahlıq**.

**MATRİKUL** [*lat.* matricula – açıq siyahı] Tələbənin qiymətləri qeyd olunan sənəd; zaçot dəftərçəsi.

**MATRİSA** [*alm.*] 1. Metal lövhələrini basqı üsulu ilə işləmək, tökmə üsulu ilə literləri və s. hazırlamaq üçün tətbiq edilən çuxur metal qəlib.

2. Mətbəədə yığılmış mətnin (hürufatın) əks surəti olan karton qəlib. *Kitabın yeni nəşri matrisadan çap olunub.*

**MATROS** [*holl.*] Hərbi donanmada: komanda heyətinə mənsub olmayan sıravi xidmətçi, habelə mülki donanmada adi dənizçi.

**MATROSKA** [*rus.*] Xüsusi biçimli, iri qatlama yaxalıqlı rəsmi matros bluzası. // Bu biçimdə uşaq və ya qadın üst bluzası. *Uşaq üçün matroska almaq.*

**MATROSLUQ** *is.* Matrosun işi, vəzifəsi. *Matrosluq kursu.*

**MAUZER** [*xüs. is.*-dən] Odlu silah sisteminin adı. // Avtomat tapança növü. *Daşdəmir əlini mauzerinin üstə qoyub qonağı gözləyirdi.* A.Şaiq. *Məşədibəy o biri tərəfə baxdığından mauzeri də, onu qaldıran adamı da görmürdü.* M.Hüseyn.

**MAVƏRA** *is.* [*ər.*] *köhn.* Nəyinsə arxasında olan, o tayında və ya gerisində olan. *Sığmadın zülmətsərayi-aləmə; Hicrət etdin mavərayi-aləmə*. A.Səhhət.

**MAVİ** *sif.* [*ər.*] Açıq-göy, aydın göy rəngində olan. *Mavi göz.* – [Orxan:] *Ey mavi göylər! Ey yaşıl ormanlar! Ey bacalardan yüksələn dumanlar!* H.Cavid. *Dəzgahlar dalında olan Aqil, başında mavi ləçəkli bir qızla danışırdı.* Q.İlkin.

**MAVİGÖZ** *sif.* Gözləri mavi rəngdə olan. *Mavigöz qız.*

**MAVİLƏŞMƏ** "Maviləşmək"dən *f.is.*

**MAVİLƏŞMƏK** *f.* Mavi rəngə düşmək, mavi rəng almaq. *Səma maviləşir.*

**MAVİLİK** *is.* Mavi rəngdə olma. *Səmanın maviliyi. Gözün maviliyi.* – *Sənə meşələrdən yaşıl xışıltı; Sənə dənizlərdən sərin mavilik; ..Gətirmişəm mən.* S.Tahir.

**MAVİMSOV, MAVİMTRAQ** *sif.* Maviyə çalar, az mavi olan. *Titrəşən mavimtraq alovlar balaca Şirin üçün əfsanəvi bir aləm idi.* İ.Əfəndiyev.

**MAVZOLÉY** [*yun.*] Qəbir üzərində tikilən böyük memarlıq abidəsi; türbə. *Mavzoley qapısında salama durmuş sükut; Mavzoleyin içində müqəddəs ulu tabut.* R.Rza.

**MAY** [*lat.*] Təqvim ilinin beşinci ayı.

**MAYA**[1] *is.* [*fars.*] 1. Bəzi qidalarda qıcqırma əmələ gətirən maddə. *Xəmir mayası. Pendir mayası.* □ **Maya vurmaq** – b a x **mayalamaq** 1-ci mənada. *Qatığa maya vurmaq.*

2. *biol.* Rüşeym, döl. *Mayası pisdir.* // *məc.* Əsas, əsil kök. *Bu torpaqdır varlığımın mayası; Bu torpaqda alın təri tökmüşəm.* S.Rüstəm. *İlham bulaqları quruyacaqdır; Hər kimin deyilsə mayası eldən.* O.Sarıvəlli.

3. Bəzi xəstəliklərə qarşı peyvənd (aşı) maddəsi. *Difterit mayası.* – *Əgər uşağa vaxtkən çiçək mayasını döysən, dəxi o uşaq çiçək naxoşluğu tutmaz.* C.Məmmədquluzadə.

4. *məc.* Mövzu, obyekt mənasında. *İndi uşaqların hansı zavoda göndəriləcəyi də söhbət mayası olmuşdu.* Ə.Əbülhəsən.

5. *məc.* Səbəb, əsas, kök, səbəbkar. [Rüstəm kişi:] *Deyirəm axı, bu qanacaq sizdə olmaz. Deməli, mayası Şərəfdəndir?* M.İbrahimov. [Sərvinaz Şahmara:] *Bu işlərin bir mayası da sənsən.* B.Bayramov.

6. Gəlir əldə etmək üçün bir şeyə qoyulan pul; sərmayə. *Dükanın mayası da Molla Cəfərqulunun idi.* N.Nərimanov. *İki-üç ildən sonra maya əldən çıxdı.* Ə.Haqverdiyev. // Ticarətə, alverə başlaya bilmək üçün əldə olan məbləğ, pul. □ **Maya qoymaq** – pul sərf etmək, pul xərcləmək, pul qoymaq.

7. Ümumiyyətlə, əldə olan pul, sərvət, dövlət. [Tacir] .. *əlində olan mayasını işə və istifadəyə buraxa bilmir.* M.S.Ordubadi. □ **Maya dəyəri (qiyməti)** *iqt.* – bir malın hazırlanmasına sərf olunan, istehsal vasitələri xərci ilə işçiyə verilən əmək haqqından ibarət istehsal xərcləri. *Məhsulun maya qiyməti.*

8. *mus.* Səs qatarlarında orta pərdə. *Əmələ gələn səs qatarlarında orta tetraxordun birinci pərdəsi maya adlanıb, ladda tonika vəzifəsini görür.* Ü.Hacıbəyov.

**MAYA**[2] *is.* [*fars.*] 1. Dişi dəvə. *Dəvə, maya, nər, köşək; Lökləyirlər dalbadal.* A.Səhhət. *Ağ mayaların üstündə oturub, yayxana-yayxana gedən qoca qarıların qucağında camış balağı, çəpiş, yaxud it küçüyü gözə*

*dəyirdi*. Ə.Vəliyev. *Bürüyür ətrafı zınqırov səsi; Ağca mayaların nərildəməsi*. M.Rahim. // Ana göyərçin. *Mayanı uçurtmaq. Maya yumurta üstündə oturub.*

2. *məc. dan.* Ağ, dolğun, gözəşirin qadın haqqında (bəzən "kimi" qoşması ilə). *Maya kimi gəlin. – Burdan bir maya getdi; Sallandı, çaya getdi; Yolunda cəfa çəkdim; Əməyim zaya getdi*. (Bayatı).

**MAYABAŞ** *sif.* və *zərf* Ticarət və ya qumarda: nə qazancı, nə də ziyanı olmadığını, mayanın olduğu kimi qaldığını bildirən söz. *Mayabaş olmaq* (*qalmaq*).

**MAYABAŞLIQ** *is.* Mayabaş olma, qazanc və ziyansız olma.

**MAYÁK** *is.* [*rus.*] Gəmilərə yol göstərmək üçün siqnal işığı olan hündür qüllə. *Kəsildi səs, daha yox bir səda, mayak da yanır.* A.Səhhət. *..Mayakın qırmızı işığı müntəzəm surətdə yanıb-sönürdü.* M.Süleymanov. // *məc.* Yolgöstərən, istiqamətverən, yolunu işıqlandıran; bir şeyin rəmzi, simvolu, əlaməti. // Yenilikçi, qabaqcıl işçi mənasında.

**MAYALAMA** "Mayalamaq"dan *f.is. Süni mayalama məntəqəsi.*

**MAYALAMAQ** *f.* 1. Maya vurmaq. *Südü mayalamaq.*

2. Döllendirmək.

3. Birinci süddən əmmək, yemək (yeni doğulmuş heyvanlar haqqında). *Möhsün balanı mayalayıb Səbanı çağırdı.* S.Rəhimov.

**MAYALANDIRMA** "Mayalandırmaq"dan *f.is.*

**MAYALANDIRMAQ** *f.* 1. Dölləndirmək. *Qoyunu mayalandırmaq*.

2. Yeni doğulmuş heyvanlara birinci süddən əmdirmək, yedirtmək. *Quzuları mayalandırmaq.*

**MAYALANMA** "Mayalanmaq"dan *f.is.*

**MAYALANMAQ** *məch.* Döllənmək (boğaz olmaq). *Ana qoyunların nə vaxt və hansı qoyunla mayalandığı, ondan hansı quzu alındığı* [jurnala] *qeyd edilir.*

**MAYALI** *sif.* 1. Maya vurulmuş, mayalanmış, maya salınmış, maya qatılmış. *Mayalı pendir.*

2. Ticarət və ya təsərrüfatla məşğul olmaq üçün mayası – pulu olan. // Ümumiyyətlə, pullu, varlı, dövlətli.

**MAYALIQ** *sif.* Maya üçün yarayan, maya üçün olan. *Mayalıq xəmir. Mayalıq qatıq.*

**MAYALLAQ** *is.* [*ər.*] Başı aşağı əyib bədənlə ayaqları o biri tərəfə aşırma. ☐ **Mayallaq aşmaq (vurmaq)** – başın üstündən o biri tərəfə çevrilmək, aşmaq. *Molla Abbas mayallaq aşır, Rüstəm və Heydər gülüşürlər.* C.Məmmədquluzadə. *Uşaqlar ayaqyalın qarın içində mayallaq vururlar.* S.Rəhimov.

**MAYAOTU** *is. bot.* Uzun gövdələri üzərində tikancıqları olan çoxillik sarmaşıq-bitki.

**MAYASIZ** *sif.* 1. Maya vurulmamış, maya qarışdırılmamış, mayası olmayan. *Mayasız fətir.*

2. Əlində mayası (pulu) olmayan.

**MAYASIZLIQ** *is.* Mayası olmayan şeyin halı.

**MAYBÖCƏYİ** *is. zool.* Sərtqanadlı, qara rəngli, zərərverici, gəmirici böcək.

**MAYE** *is.* [*ər.*] Axmaq və kəmiyyətini dəyişmədən olduğu qabın şəklini almaq xassəsinə malik olan maddə. *Şüşənin içində bulanıq maye var.* // Sif. mənasında. *Maye cisim.*

**MAYEHTAC** *is.* [*ər.*] Lazım olan, gərək olan, ehtiyat üçün, ehtiyacı ödəmək üçün hazırlanan şeylər. *Səfər mayehtacı.* – [Qarı:] *Bala, biz qış mayehtacını yığmaqdan ötrü qırx günlük səfərə getməliyik.* (Nağıl). [Səlim bəy:] *Axşamdan yüzbaşını çağırıb tapşırdım: – Sabah ova gedəcəyəm, gərək hər bir mayehtac hazır olsun.* Ə.Haqverdiyev.

**MAYELƏŞDİRİLMƏ** "Mayeləşdirilmək"-dən *f.is.*

**MAYELƏŞDİRİLMƏK** *məch.* Maye halına salınmaq, durulaşdırılmaq.

**MAYELƏŞDİRMƏ** "Mayeləşdirmək"dən *f.is.*

**MAYELƏŞDİRMƏK** *f.* Maye halına salmaq; durulaşdırmaq. *Qazı mayeləşdirmək.*

**MAYELƏŞMƏ** "Mayeləşmək"dən *f.is.*

**MAYELƏŞMƏK** *f.* Maye halına keçmək; durulaşmaq. *Buxar mayeləşir.*

**MAYGÜLÜ**[1] b a x **mixəkgülü**.

**MAYGÜLÜ**[2] *is. zool.* Bir çox növləri olan başı, boğazı və döşü sarı-qırmızı və ya tünd-qırmızı rəngli su quşu; suferəsi.

**MAYIF** *sif.* [*ər.*] Şikəst, əlil, eyibli, nöqsanlı. [Hacı:] *Kor olsun, topal olsun, mayıf olsun, övlad olsun!* Mir Cəlal.

**MAYIFLAŞMA** "Mayıflaşmaq"dan *f.is.*

**MAYIFLAŞMAQ** *f.* Əlil olmaq, şikəst olmaq.

**MAYIFLIQ** *is.* Mayıf olma; şikəstlik, əlillik.

**MAYİS** *köhn.* bax **may**. *Mayisin dadlı gecələrindən idi.* Çəmənzəminli. [Knyaz:] *Bir mayis dəvət edildim Batuma.* H.Cavid.

**MAYİSGÜLÜ** bax **maygülü**[1]. *Bahara məxsus ağ buludlar mayisgülünün qırmızı yanaqlarını kirşanlamağa hazırlaşırdı.* M.İbrahimov.

**MAYKÁ** [*rus.*] Qolsuz və ya qısaqollu, yaxalıqsız trikotaj yay köynəyi. *İdmançı maykası. – Qırmızı yaxalıqlı ağ mayka geyinmiş gənc, sağlam cavanlar dəstə-dəstə, dalğa kimi küçələrə doluşurdu.* Mir Cəlal.

**MAYKALI** *sif.* Mayka geymiş, əynində mayka olan. *Məmməd sarı maykalı rəqibini geridə buraxdı.* H.Seyidbəyli.

**MAYQABAĞI** *sif. tar.* May bayramı ərəfəsində, yaxud yaxınlaşan may bayramı şərəfinə olan. *Mayqabağı yarış.*

**MAYMAQ** *sif.* Çox huşsuz, key, fərasətsiz, bacarıqsız, aciz-avara. *Maymaq uşaq.* // İs. mənasında. *Maymağın biridir.* – [Bayram:] *Onun üçün istəyir səni öz oğluna, .. o maymağa verə ki, ömründə bir sərçə vurduğu, bir quzu oğurladığı yoxdur.* M.F.Axundzadə. *İşi o yerə gətirib çıxartmısan ki, Xəlil kimi bir maymaq səni pis qələmə verəndə buna hamı inanır.* M.Hüseyn.

**MAYMAQCASINA** *zərf* Maymaq kimi, mənasız-mənasız. *Maymaqcasına baxmaq.*

**MAYMAQLIQ** *is.* Maymaq adamın hal və xüsusiyyəti. *Sən onun elə maymaqlığına baxma, yamanca saman altından su yeridəndir.* S.Rəhimov.

**MAYÓR** [*lat.*] Kapitandan sonra gələn zabit rütbəsi, habelə belə rütbəsi olan adam. [Qonaqların] *yanında Tahirin ilk dəfə gördüyü təyyarəçi bir mayor da vardı.* M.Hüseyn.

**MAYORLUQ** *is.* Mayor rütbəsi.

**MÁYYA** *is.* [*sanskr.*] Qədim və orta əsr hind fəlsəfəsində universal anlayışlardan biri.

**MÁYYA-SÓKE** *is.* Cənubi Afrikada dil ailəsi.

**MAZ** [*rus.*] 1. Dəriyə sürtmək üçün tərkibində dərman maddələri olan qatı yağ qatışığı.

2. Hər hansı bir şeyi yağlamaq üçün qatı yağlı maddə. *Ayaqqabı mazı.*

**MAZAQ** *is.* [*ər.*] *vulq.* Zarafat, əylənmə, dilxoşluq (adətən kişi ilə qadın arasında). ◻ **Mazaq etmək (eləmək)** – əylənmək, zarafatlaşmaq, dilxoşluq etmək. [Xan:] *Baxın, Pərviz xanın baş hərəmi öz ərinin gözünün qabağında nökər ilə mazaq eləyir.* Ə.Haqverdiyev.

**MAZAQLAŞMA** *vulq.* "Mazaqlaşmaq"-dan *f.is.* [Süleyman:] *..Bütün kolxoz Tofiqin* [Atlazla] *mazaqlaşmasından danışır.* M.İbrahimov.

**MAZAQLAŞMAQ** *qarş. vulq.* Dilxoşluq etmək; zarafatlaşmaq, oynaşmaq. [Pəricahan:] *Ağa əvvəllər mənlə mazaqlaşardı.* S.S.Axundov. [Çərkəz:] *Günü qara lap özünü açıb, – deyə xəyalından keçirdi, – indidən mazaqlaşmaq istəyir. Allah sizin damazlığınızı kəssin. Boyları bir qamçı olan kimi adamın belinə sıçrayırlar.* İ.Şıxlı.

**MAZARAT** *is.* [*ər.*] *dan.* 1. Ziyan, zərər. *Dövlətlidən xeyir* [*olmaz*], *kordan mazarat.* (Ata. sözü).

2. Müzür adam, mərdimazar. *Aradan seçmək gərək; Ziyançını, mazaratı.* Aşıq Əli. *Mazaratı axtarmaq lazım deyil, o özü tapılır.* S.Rəhimov.

**MAZAT** *is.*: **özünü mazata qoymaq** *dan.* – naz eləmək, təşəxxüs satmaq. [Balaqız Gülnisəyə:] *Nahaq yerə özünü mazata qoyma!* Ə.Haqverdiyev.

**MÁZER** *is.* [*ing.*] Radiodalğalar diapazonunda işləyən kvant generatorunun adı.

**MAZĞAL** *is.* Qala divarlarında və s.-də atışma üçün qoyulan deşik. *O, bu sərrast güllələrin əncüməndəki mazğaldan atıldığını öyrənəndə, qudurub bütün top və tüfənglərin atəşini bu mazğala çevirməyi əmr etdi.* P.Makulu.

**MAZĞALLI** *sif.* Mazğalı olan. *Dırmaşmışdı uşaqlar; Mazğallı divarlara.* Ə.Cavad.

**MAZI** *is.* 1. Bəzi ağacların üzərində həşərat yumurtacıqlarından əmələ gələn yumru fır (ur). *Ağacda var mazılar; Könlüm səni arzular; Əyil, üzündən öpüm; Qoy baxsın tamarzılar.* (Bayatı). *..Bir xəlvət yerdə bir belə şəkil çəkilib: deyəsən, heyvan kimi bir şeyə oxşayır, altında bir neçə əlif yazılıb, yanında bir neçə yumru, mazıya oxşar bir şey çəkilib.* C.Məmmədquluzadə.

2. Mazı-mazı oyununda işlədilən daş kürəcik.

**MAZI-MAZI** *is.* Düz və hamar yerdə mazı (2-ci mənada) ilə oynanılan oyun. *Mazı-mazı oynayan on yeddi-on səkkiz yaşındakı gənclərin səsindən qulaq tutulurdu.* Çəmənzəminli.

**MAZİ** *is.* [*ər.*] 1. *klas.* Keçmiş zaman, keçmiş. *Qəmli mazisini hekayət edər; Taleyindən bütün şikayət edər*. A.Səhhət. [Qətibə:] *Mazilərimiz bəşəriyyətin gəncliyi dəfn edilən bir məzardır.* M.S.Ordubadi.

2. *qram.* Felin keçmiş zamanının köhnə adı.

**MAZLAMA** "Mazlamaq"dan *f.is.*

**MAZLAMAQ** *f.* 1. Maz sürtmək, maz çəkmək. *Ayaqqabını mazlamaq.* // *məc. zar.* Üzünə yağ və ya başqa bir şey çəkmək.

2. *məc. dan.* Üstünü malalamaq, ört-basdır eləmək.

**MAZLI** *sif.* Maz sürtülmüş, maz çəkilmiş.

**MAZÚRKA** [*pol.* mazurek] Üçölçülü taktı olan polyak milli rəqsi, habelə həmin rəqsin musiqisi. *Mazurka oynamaq.* // Həmin rəqs ritmində musiqi əsəri. *Şopenin mazurkası.*

**MAZÚT** *is.* Neftdən ağneft, benzin və qazolin ayrıldıqdan sonra qalan yağlı qatı maddə. *Qıra mazut qatmaq. Yanan mazutdan çıxan his. – Daşı, duzu, mazutu, torpağı cavahirdir; Xəzinələr elimin hər yerində zahirdir.* Ə.Vahid.

**MAZUTLAMA** "Mazutlamaq"dan *f.is.*

**MAZUTLAMAQ** *f.* Mazut sürtmək, üzərinə mazut çəkmək; mazuta bulamaq. *Borunu mazutlamaq*.

**MAZUTLANMA** "Mazutlanmaq"dan *f.is.*

**MAZUTLANMAQ** *məch.* Mazut sürtülmək, mazut çəkilmək; mazuta bulanmaq.

**MAZUTLU** *sif.* Mazut sürtülmüş, mazuta bulanmış, mazutu olan. *Qənbərli mazutlu əli ilə gözlərini ovdu*. S.Rəhimov. [Fərhad Dilaraya:] *Mazutlu çalalardan neft yığan bu uşaqları görürsünüzmü?* Ə.Məmmədxanlı.

**MAZUTLUQ** *is.* Mazut tökülmüş yer. *Mədənlərin ətrafı mazutluqdur*.

**MÉBEL** [*fr.*] Stol, stul, taxt, şkaf, şifoner və s. kimi ev avadanlığı. *Mebel fabriki. Yumşaq mebel*. – [Mindilli:] *Bu gün sizin üçün yaxşı mebel sifariş elədim.* S.Rəhman. *Hamballar bir dəst mebel gətirib otaqlara düzdülər.* Mir Cəlal.

**MEBELÇİ** *is.* Mebel sənayesi işçisi, mebel ustası.

**MEBELÇİLİK** *is.* Mebelçi peşəsi, ixtisası.

**MEBELLİ** *sif.* Mebeli olan, mebellə təchiz olunmuş. *Mebelli otaq.*

**MEDÁL** [*fr.*] Xüsusi xidmətlərinə, yaxud əməkdə göstərdiyi rəşadətə görə verilən, üzərində hər hansı bir qabarıq təsvir və ya yazı olan fərqlənmə nişanı. "*Əməkdə fərqlənməyə görə*" *medalı.* – [Tarverdi:] ..*Yalan olsa, mənə verən medalları Aslan bəyə verərsən.* C.Cabbarlı. [Aslan] *igid idi, sol döşünün üstündə bir medal vardı*. Ə.Vəliyev. // Yüksək müvəffəqiyyətlərinə görə məktəbi bitirdikdə şagirdlərə, habelə müsabiqədə, yarışda, baxışda və s.-də fərqlənənlərə verilən belə nişan. *Qızıl medal. Çempionluq medalı. Məktəbi medalla bitirmək.* // Hər hansı tarixi hadisə və ya görkəmli xadimin xatirəsi münasibətilə hazırlanmış belə nişan. *Füzuli yubileyinə həsr olunmuş medal.*

**MEDALÇI** *is.* 1. Məktəbi, kursu bitirdikdə yüksək müvəffəqiyyətlərinə görə medal almış (adam).

2. Sərgidə, baxışda medalla təltif edilmiş ev heyvanı.

**MEDALLI** *sif.* Medal almış, medalla təltif olunmuş, yaxud döşünə medal taxmış. *Medallı əsgər.*

**MEDALYÓN** [*fr.*] 1. İçərisinə şəkil və ya başqa bir şey qoyulan girdə və ya uzunsov kiçik qutu şəklində zərgərlik məmulatı. *Eşqimdən nişana saxla sən bunu; Deyə o, mücrüdən zər medalyonu; Çıxarıb istəyir taxa boynuna.* B.Vahabzadə.

2. *incəs*. Hər hansı bir bəzək və ya şəkil üçün çərçivə vəzifəsi görən dairə, oval, habelə bu cür çərçivəyə salınmış şəkil, qabarıq ornament və s. *Kompozisiya vazanın ortasındakı dörd medalyondan və bütün vazanı əhatə edən Azərbaycan milli naxışlarından ibarətdir.*

**MEDİA** *is.* [*lat.*] Dövri mətbuat.

**MEDİTASİYA** *is.* [*lat.*] *fəls*. Məqsədi insan psixikasını dərin dalğınlıq vəziyyətinə gətirən əqli fəaliyyət. *Meditasiyanın psixoterapevtik cəhətləri. Meditasiya üsulları müxtəlifdir.*

**MEDİUM** *is.* [*lat.*] Ruhlar aləmi ilə canlı insanlar arasında əlaqə yaradan şəxs.

**MEDYE** *is.* [*mac.*] Macarıstanda inzibati-ərazi vahidi (tərkibinə dairə və şəhərlər daxildir).

**MEDUZA** [yunan əsatirində qanadlı əjdaha adından] *zool.* Bədəni həlməşik maddədən ibarət çoxayaqcıqlı dəniz heyvanı. *Meduza açılmış və dəstəsilə suya batırılmış çətirə oxşayır. Meduza üzdüyü zaman onun qabarıq tərəfi yuxarıya çevrilmiş olur.* "Zoologiya".

**MEGERA** *is.* [*yun.*] Qədim yunan mifologiyasında qisasçı ilahələrdən birinin adı.

**MEH** *is.* [*fars.*] Xəfif yel, yüngül, yumşaq yel, sakit külək. *Meh əsir. Meh gəlir. – Yumşaq göy çəmənin üstə düşüb şeh gecədən; İsti yoxdur, hələ var bir balaca meh gecədən.* A.Səhhət. *İndi çöldə xəfif meh əsdiyi üçün hava bayaqkı qədər bürkü deyildi*. İ.Əfəndiyev.

**MEHLİ** *sif.* Meh əsən, xəfif küləkli. *Mehli səhər.*

**MEHMAN** *is.* [*fars.*] Qonaq. *Bir-iki gün ki, sənə, ey nigar, mehmanəm; Nolur əgər tutasan hörmətin bu mehmanın?* S.Ə.Şirvani. ◻ **Mehman etmək (eləmək)** – qonaq etmək, qonaq saxlamaq. *Qədəm basıb bizə gəlsin nagahi; Bir gecə mən onu mehman eyləyəm.* M.P.Vaqif. **Mehman olmaq** – qonaq olmaq. *Olsa bir şaxs gər sənə mehman; Eylə ol şaxsə ehtirami-tamam.* S.Ə.Şirvani.

**MEHMANXANA** *is.* [*fars.*] Başqa yerdən gələnlərin müvəqqəti yaşaması üçün xüsusi təchizatlı otaqları olan ev; qonaq evi. [Mozalanbəy:] *Gəncədə düşmək üçün yaxşı mehmanxanalar varmı?* Ə.Haqverdiyev.

**MEHMANXANAÇI** *is. köhn.* Mehmanxana sahibi, mehmanxana saxlayan adam.

**MEHMANXANAÇILIQ** *is. köhn.* Mehmanxana saxlamaqla məşğul olma, mehmanxana işi. *Mehmanxanaçılıq həyatında bu cürə qadınlara tez-tez təsadüf edirəm.* M.S.Ordubadi.

**MEHMANNƏVAZ** *sif.* [*fars.*] Qonaqcıl, qonaqpərəst. *Mehmannəvaz adam*.

**MEHMANNƏVAZLIQ** *is.* Qonaqpərəstlik. *Vaqiən İranın mehmannəvazlığının mislini qeyri yerdə, zənn edirəm, görmək olmaz.* C.Məmmədquluzadə. *Qədirin də, Qumrunun da mehmannəvazlığına etina etməyən Bədir bəy yerini dəyişmədi.* Mir Cəlal.

**MEHPARƏ** *klas.* b a x **mahparə**. *Yanağın şəminə hüsni-Yusifin pərvanədir; Çox könüllər yağmalandı sən yüzi-mehparədən*. Nəsimi. *Yoxsa kəndimizin o mehparəsi; Qismət olmayacaq sənə, yaxşı bil.* M.Müşfiq.

**MEHR**[1] *is.* [*fars.*] *klas.* Sevgi, məhəbbət. *Könlün xoş isə, təbəssüm eylə! Mehrin var isə, tərəhhüm eylə!* Füzuli. *Mənə ol mahimehrim yəqinimdir ki, ram olmaz; Dedim ki, mehri çıxmaz sinədən, ömrüm tamam olmaz.* S.Ə.Şirvani. ◻ **Mehr etmək** – məhəbbət göstərmək, mehribanlıq göstərmək. *Hər yanda bir məh olsa mənə mehriban idi; Mehr etməz idim sahibi-xanə yavaş-yavaş.* Q.Zakir. **Mehr(ini) salmaq** – məhəbbətini salmaq, sevmək, ürək bağlamaq, əzizləmək. *Qız daim ata evində qalmaz; Peyvəstə anaya mehr salmaz.* Füzuli. *Cuma, mehrini böyük oğlu Azada salmağa çalışmışdı.* Ə.Əbülhəsən. **Mehrini kəsmək** – istədiyi adamdan soyumaq, üz döndərmək. *Kəsmə məndən mehri, ey xurşid iqbal.* Qövsi.

**MEHR**[2] *is.* [*ər.* məhr] Köhnə məişətdə: evlənən kişi tərəfindən aldığı qadına – qıza nikahda talaq üçün təyin edilən pul; kəbin pulu. [Hacı Qəmbər:] *Dilbər əgər artıq-əskik danışsa, mehrin qoyaram qabağına, deyərəm: – Xoş gəldin!* N.Vəzirov. *Xörəkdən, çörəkdən nə gəlsə yeyib-içib söz açarlar ki,* "*mehr nə qədər olacaqdır?*" R.Əfəndiyev. ◻ **Mehr kağızı** *köhn.* – kəbin kağızı, əqd kağızı, nikah kağızı. *Sarıqlı molla mehr kağızını qurtarmamış gözünü hərləyib içəri qapıya zillədi*. Mir Cəlal. **Mehr vermək** *köhn.* – kəbin pulunu verib boşamaq. *Yasəmən onun evindən əl götürmək, yorucu əzabdan qurtarmaq istəyirdi, mehr vermək də Məhərrəm üçün imkansız idi*. Mir Cəlal.

**MEHRAB** *is.* [*ər.*] Məscidlərin qiblə tərəfdəki divarında namaz qılarkən pişnamazın və onun ardınca başqa namaz qılanların üzlərini çevirdikləri oyuq yer. *Zahidin mehrab içində zikrü taətdir işi*. Nəsimi. *Axund mehraba çatdıqda ayaq üstə dayanar və camaat namazına başladıqda camaat da ona iqtida edərdi.* H.Sarabski.

**MEHRİBAN** *sif.* [*fars.*] Çox yaxşı münasibət bəsləyən, səmimi, mehr bəsləyən, şəfqətli, xoş rəftarlı. *Mehriban qadın.* – [Xədicə] *olduqca xoşsöhbət, eyi təbiətli, geniş qəlbli, munis və mehriban bir qız idi.* S.Hüseyn. *Mehriban sevgilim qarşımda durdu; Yenə şairliyim başıma vurdu.* M.Müşfiq. // Mehribanlıq ifadə edən; səmimi, xoş. *Mehriban münasibət. – Siması şəhlayi, tərhi badəmi; Baxışı mehriban, özü hərami.* M.P.Vaqif. *Məhərrəm özünə yer axtarmaqda ikən müsafir mehriban nəzərlə Məhərrəmə baxdı.* H.Nəzərli.

**MEHRİBANANƏ** [*fars.*] b a x **mehribancasına**. *Cəlil ağa Şəfiqəni yanına çağırıb, çox mehribananə söhbət başladı.* İ.Musabəyov.

**MEHRİBANCASINA** *zərf* Mehribanlıqla, dostcasına, səmimiyyətlə. *Mehribancasına qəbul etmək.*

**MEHRİBANÇILIQ** *dan.* b a x **mehribanlıq**. [Məmmədhəsən əmi:] *İş düz gətirməz, ortalıqdan mehribançılıq götürülər.* C.Məmmədquluzadə. [Kəblə Rəcəbəli:] *Dünyada mehribançılıqdan gözəl şey yoxdur*. Ə.Haqverdiyev. [Qulu:] [Yusifin] *xasiyyəti və mehribançılığı məni özünə qul edibdir.* N.Nərimanov.

**MEHRİBANLAŞMA** "Mehribanlaşmaq"-dan *f.is.*

**MEHRİBANLAŞMAQ** *f.* Mehriban olmaq, dostlaşmaq, ünsiyyət bağlamaq. *Bakıdan gələn arvad 3-4 gün kəndimizdə qalıb, bəzi arvadlarla lap mehribanlaşdı.* Qantəmir. *..Sülh zamanı qaraqabaq olanlar belə mehribanlaşır, bir-birinə təsəlli verir.* Ə.Əbülhəsən.

**MEHRİBANLIQ** *is.* Münasibətdə xoşluq, səmimilik, xoşrəftarlıq, dostluq, mehriban münasibət. *Mehribanlıq görməyib bir məhliqadən küsmüşəm; Gündə yüz al eyləyən qəlbi qəradən küsmüşəm.* M.P.Vaqif. *Mehribanlıq beşiyimdir; Yerim bağça, yurdum bağdır; Alnım açıq, üzüm ağdır.* S.Vurğun. ◻ **Mehribanlıq etmək (qılmaq)** – mehriban olmaq, səmimilik göstərmək, xoş münasibət göstərmək, yaxınlıq etmək. *Çün ol sənə qıldı mehribanlıq; Yaxşılığa eyləmə yamanlıq.* Füzuli.

**MEHRLƏNMƏ** "Mehrlənmək"dən *f.is.*

**MEHRLƏNMƏK** *f.* Mehr salmaq; alışmaq, isinişmək.

**MEHRSİZ** *sif.* Sevgisi, məhəbbəti olmayan; məhəbbətsiz. *Leyli, gər olaydı bir həyasız; Ya sən kimi mehrsiz, vəfasız*. Füzuli.

**MEHTƏR** *is.* [*fars.*] Ata qulluq edən, atabaxan. *Mehtərlər də atları çəkdilər Aslan paşanın qabağına*. "Koroğlu". *İtlərin hürməyi, ovçuların səsləri, nökər və mehtərlərin qışqırığı bir-birinə qarışmışdı*. S.S.Axundov.

**MEHTƏRBAŞI** *is.* Keçmişdə: paşaların, xanların, bəylərin atlarına baxan mehtərlərin başçısı; baş mehtər. *Aslan paşa əmr elədi, mehtərbaşı qabaqca Dəmirçi oğlunun atını minib gərdişə gətirdi.* "Koroğlu". *Şah oğlu Şah Abbas mehtərbaşının üzünə baxdı.* "Qurbani".

**MEHTƏRXANA** [*fars.*] *is.* Atların saxlandığı yer, tövlə. [Nuşapəri] *atasının mehtərxanasına düşüb, handa bir yaxşı atı minib, üz qoydu şəhərdən çıxmağa.* (Nağıl).

**MEHTƏRLİK** *is.* 1. Mehtərin işi, vəzifəsi. [Səfərəli:] *Ağa, mən sizə aşpazlıq eyləyəcəyəm, ya mehtərlik?* N.Vəzirov. *Sarı, Dəmirova müraciət etdikdən sonra əmisi oğlu Qaranı göyxallı atın mehtərliyinə keçirmişdi.* S.Rəhimov.

2. *köhn.* b a x **mehtərxana**. [Güldəstə:] *Rüstəm bəy də nökərləri ilə mehtərliyə girib, rəiyyəti ilə atışır.* Ə.Haqverdiyev.

**MEHVƏR** *is.* [*ər.*] 1. Öz ətrafında fırlanan bir şeyin ortasından keçən mil, ox.

2. Yer kürəsinin mərkəzindən keçərək iki qütbü bir-birinə birləşdirən xəyali xətt.

3. *məc.* Bir şeyin əsasını, məğzini təşkil edən amil. *Bu sözlər danışılan bütün danışıqların mehvəri idi.* Ə.Əbülhəsən.

**MEXÁNİK** [*yun.*] 1. Mexanika mütəxəssisi.

2. Maşınların işləməsinə nəzarət edən, maşını işlədən adam. *Təyyarəçi, mexanik və miniklər təyyarədən çıxıb liftə oturdular.* Çəmənzəminli. *Kursu başa vurub qayıtdı Rizvan; Kolxozda birinci mexanik oldu*. B.Vahabzadə.

**MEXÁNİKA** [*yun.* mechanike – alət] 1. Fizikanın, cisimlərin boşluqda (fəzada) yerdəyişmə qanunlarından bəhs edən şöbəsi. *Nəzəri mexanika*. // Texnikanın, hərəkət və qüvvə haqqındakı nəzəriyyənin praktik mə-

sələlərin həllində tətbiqi ilə məşğul olan sahəsi. *Tikinti mexanikası.* // Maşın, mexanizm, qurğu.

2. *məc.* Bir şeyin mürəkkəb gizli daxili cəhəti, mahiyyəti. *İnqilabın mexanikası.*

**MEXANİKİ** *sif.* [*yun.* mechanike və *ər.* ...i] 1. Mexanikanın öyrəndiyi hadisə və proseslərə aid olan. *Mexaniki hərəkət.*

2. Mexanizmlər vasitəsilə işləyən, hərəkətə gətirilən, mexanizmi olan; mexanizmli. *Mexaniki mişar.* – [Musa dayı] *daşları qaldırıb dişəmək üçün mexaniki bir şey icad etmişdir.* İ.Əfəndiyev.

3. Maşın və mexanizmlərin hazırlanması, təmiri ilə məşğul olan. *Mexaniki sex. Mexaniki emalatxana.*

4. B a x **mexanistik**.

5. *məc.* Qeyri-şüuri, qeyri-iradi. *Mexaniki hərəkət. – Sərhəng heç bir şey başa düşməsə də, mexaniki olaraq: – Bəçeşm, – deyib təzim etdi*. M.İbrahimov.

**MEXANİKİLİK** *is.* Qeyri-şüurilik, qeyri-iradilik.

**MEXANİKLƏŞDİRİLMƏ** "Mexanikləşdirilmək"dən *f.is.*

**MEXANİKLƏŞDİRİLMƏK** *məch.* Maşın və mexanizmlər tətbiq edilmək. *Kənd təsərrüfat işləri daha çox mexanikləşdirilir.* // Əl əməyi maşın və mexanizmlərin işi ilə əvəz edilmək. *Pambıq yığımı mexanikləşdirilib. Ağır işlərin çoxunun mexanikləşdirildiyi bir zamanda maşınlardan səmərəli istifadə olunması diqqət mərkəzində durmalıdır.*

**MEXANİKLƏŞDİRMƏ** "Mexanikləşdirmək"dən *f.is.*

**MEXANİKLƏŞDİRMƏK** *f.* Maşın və mexanizmlər tətbiq etmək. // Əl əməyini maşın və mexanizmlərin işi ilə əvəz etmək. *Çay yığımını mexanikləşdirmək.*

**MEXANİKLƏŞMƏ** "Mexanikləşmək"dən *f.is. Mexanikləşmə artdıqca kənddə çilingərə ehtiyac daha da çoxalır*. Ə.Sadıq.

**MEXANİKLƏŞMƏK** *f.* Maşın və mexanizmlər tətbiq edilmək. // Əl əməyi maşın və mexanizmlərin işi ilə əvəz edilmək.

**MEXANİKLİK** *is.* Mexanikin sənəti, peşəsi, vəzifəsi. [Murad] *ömrünün bir qismini Xəzər dənizində mexaniklikdə keçirdiyi üçün motor işlətməyi bilirdi*. S.Hüseyn.

**MEXANİSİST, MEXANİST** [*yun.*] Mexanisizm tərəfdarı.

**MEXANİSİ́ZM** [*yun.*] Nəticə etibarilə materiyanın hərəkət formalarının keyfiyyətcə müxtəlifliklərinin mexaniki hərəkətdən, inkişafın mürəkkəb və çoxcəhətli qanunauyğunluqlarının isə mexanikanın ən bəsit qanunlarından başqa bir şey olmadığını iddia edən antidialektik fəlsəfi cərəyan.

**MEXANİSTİK** *sif.* Mexanisizmə aid olan, mexanisizm prinsiplərinə əsaslanan. *Mexanistik nəzəriyyə.*

**MEXANİZÁTOR** [*yun.* mechane-dən] Maşın və mexanizmlərə xidmət edən mütəxəssis (əsasən, kənd təsərrüfatında). *Çinarlı .. mexanizatorları payız əkininə vaxtında başlamışlar*. Ə.Vəliyev.

**MEXANİZATORLUQ** *is.* Mexanizatorun işi, peşəsi.

**MEXANİ́ZM** [*yun.* mechane – alət] 1. Maşını, aparatı, cihazı və s.-ni hərəkətə gətirən daxili hissəsi. *Saatın mexanizmi.* // Bir işi görmək üçün maşın, qurğu və s. *Qaldırıcı mexanizm. – Cəmil buruqdakı mexanizmlərin adını deyə-deyə onlardan hər birisinin vəzifəsini qısaca izah etməyə başladı.* M.Hüseyn. *..Teymurgilin köhnə məhəlləsinə cürbəcür mexanizmlər gətirilir.* H.Seyidbəyli.

2. *məc.* Bir şeyin daxili quruluşu, sistemi. *Dövlət mexanizmi.*

3. Fiziki, kimyəvi, fizioloji və b. hadisələri törədən vəziyyət və proseslərin məcmusu. *Təfəkkür mexanizmi. Kimyəvi reaksiya mexanizmi.*

**MEXANİZMLİ** *sif.* Mexanizmi olan, mexanizmlə işləyən.

**MEKSİKALI(LAR)** *cəm* Meksikada yaşayan xalq.

**MEQA** *is.* [*yun.*] Söz tərkibində böyüklük mənasını bildirən ön hissə. *Meqafon.*

**MELANXOLİYA** *is.* [*yun.*] 1. Əzablı ovqat, yavaş hərəkət etmə, çətin düşünmə ilə səciyyələnən xəstəhallıq.

2. Qüssə, kədər, qəmli əhval-ruhiyyə.

**MELASSA** *is.* [*fr.*] Heyvan yemi kimi istifadə olunan şəkər çuğunduru tullantısı, qara patka; mət.

**MELXİÓR** *is.* [*fr.*] Misin nikellə ərintisi; xəlitə.

**MELİNÍT** *is.* [*yun.*] Aromatik nitrobirləşmə; partlayıcı maddə.

**MELİORÁSİYA** [*lat.* melioratio – yaxşılaşdırma] Təbii şəraiti pis olan torpaqları kökündən yaxşılaşdırmaq və onların məhsuldarlığını artırmaq üçün görülən tədbirlər sistemi (süni suvarma, bataqlıqları qurutma, sututarlar düzəltmə və s.).

**MELİORATİV** *sif.* [*lat.*] Meliorasiyaya aid olan, meliorasiya ilə əlaqədar olan. *Qarayonca əkinlərinin çox mühüm meliorativ əhəmiyyəti vardır.* "Pambıqçılıq".

**MELİORÁTOR** [*lat.*] Meliorasiya mütəxəssisi.

**MÉLİYA** *is. bot.* İkiləpəli bitki fəsiləsindən ağac və ya kol cinsi.

**MELÓDİYA** [*yun.* melodia – nəğmə, hava] 1. Müəyyən musiqi vəhdəti əmələ gətirən səslərin ahəngdar ardıcıllığı; hava, motiv.

2. Ahəngdarlıq, melodiklik.

**MELODİK** *sif.* [*yun.*] 1. Melodiyaya aid olan. *Nəğmənin melodik quruluşu.*

2. Ahəngdar, qulağa xoş gələn. *Melodik səs.*

**MELÓDİKA** [*yun.*] *mus.* 1. Melodiya haqqında elm.

2. Hər hansı bir kompozitorun, xalqın musiqi yaradıcılığına, yaxud musiqi əsərinə (janrına) xas olan melodik vasitələrinin məcmusu.

**MELODİKLİK** *is.* Ahəngdarlıq, axıcılıq, gözəllik (səsdə).

**MELODRÁM** [*yun.* melos – mahnı və drama – hadisə] 1. Mövzusunda mübaliğəli dramatik gərginlik, zahiri effekt və həyəcanlı səhnələr olan dramatik janr, habelə bu janrda əsər.

2. Öz hiss və həyəcanlarını həddindən artıq faciəli və qeyri-təbii şəkildə ifadə etmə.

3. *köhn.* Musiqisi və mahnısı olan dram.

**MELODRAMATİK** *sif.* [*yun.*] 1. Melodrama aid olan, melodrama xas olan. *Melodramatik rol.*

2. Həddən artıq gərgin, şişirdilmiş, qeyri-təbii, melodramda olduğu kimi.

**MELODRAMATİZM** [*yun.*] Bir şeyin melodramda olduğu kimi həddindən artıq həssaslıqla və qeyri-təbii təsvir edilməsi.

**MEMAR** *is.* [*ər.*] Memarlıq mütəxəssisi; arxitektor. [Sənubər Pərşana:] *Bu çox ciddi işdir, inanılmış, nə bilim, sınanmış, təcrübəli memara vermək lazımdır.* B.Bayramov.

**MEMARLIQ** *is.* Binaları layihələndirmə, tikmə və bədii cəhətdən tərtib etmə sənəti; arxitektura. // Tikintinin bədii üslubu, xarakteri. *Şərq memarlığı.*

**MEMBRÁN** [*lat.*] *tex.* Səs dalğalarını tutmaq və təkrarlamaq üçün lazım olan titrəyişlər əmələ gətirən elastik materialdan nazik lövhəcik və ya pərdə. *Telefonun membranı.* – *Veys* [Ağasəfərin] *sözünü kəsdi və membranı valın üstündən çəkmək istədi.* Ə.Əbülhəsən.

**MEMORÁNDUM** [*lat.*] Hər hansı bir məsələ haqqında hökumətin fikirləri izah edilmiş diplomatik sənəd.

**MENECMENT** *is.* [*ing.*] Gəliri artırmaq üçün idarəetmə üsulları və prinsipləri.

**MENİNGÍT** [*yun.*] *tib.* Beyin qişalarının iltihabı.

**MENNO** *is. din.* Protestant təriqəti.

**MENŞEVİK** [*rus.*] Menşevizm tərəfdarı, antimarksist opportunist partiyanın üzvü.

**MENŞEVİKLİK** *is.* Menşevizmə mənsubiyyət, menşevizm.

**MENŞEVİZM** [*rus.*] *tar.* Rusiya Sosial-Demokrat Fəhlə Partiyasında əksinqilabi xırda burjua opportunist cərəyanı; reformizmin bir növü.

**MENTALİTET** *is.* [*ing.*] Xalqın ruhunun və vərdişlərinin təzahürü; xilqət.

**MENTÓL** [*lat.* mentha – nanə və oleum – yağ] Kəskin nanə qoxusu verən şəffaf kristal maddə (təbabətdə, şirniyyat istehsalında və s.-də işlədilir). *Nanə .. növünün yağında 38-65% mentol olduğundan mentol almaq üçün əsas xammal sayılır.* M.Qasımov.

**MENUÉT** *is.* [*fr.*] Fransız rəqsi.

**MENYU** [*fr.*] Restoran, aşxana və kafedə yeməklərin adları olan siyahı. *Menyuya baxmaq.*

**MÉNZULA** [*lat.* mensula – kiçik stol] Bir yerin topoqrafik planını çəkmək üçün geodezik alət.

**MENZÚRA** *is.* [*lat.*] Musiqi alətlərində səs mənbəyi ölçülərini hesablamaq üçün məlumat.

**MENZÚRKA** [*rus.* əsli *lat.* mensura – ölçü] Mayelərin həcmini dəqiq ölçmək üçün böl-

gülü şüşə və ya stəkan. [Aydın] *iynənin menzurkasında əvvəl bir qədər qan gördü.* H.Seyidbəyli.

**MER** *is.* [*fr.*] İcra hakimiyyəti başçısı.

**MERAC** *is.* [*ər.*] İslamda Məhəmməd peyğəmbərin Allahla danışmaq üçün göyə qalxması. *Namaz möminin meracıdır.*

**MEREJKÁ** [*rus.*] Parçadan çıxarılan sapların yerində seyrək deşiklərlə tikilən naxışlı tikmə. *Süfrənin kənarını merejka etmək.*

**MEREJKALI** *sif.* Merejka edilmiş, merejka salınmış, merejkası olan. *Merejkalı dəsmal.*

**MERİDİÁN** [*lat.* meridianus – günorta] *coğr.* Yer kürəsinin hər iki qütbündən keçib ekvatoru düzbucaq şəklində kəsən xəyali qapalı əyri xətt. □ **Göy meridianı** *astr.* – Yer kürəsinin qütblərindən keçən və müşahidə yerinin zeniti olan xəyali əyri xətt.

**MERİNOS** [*isp.* merino] 1. Nazik ağyunlu qoyun cinsi, habelə bu cinsdən olan qoyunun özü. *Qafqaz merinosu.*

2. Həmin qoyunun yunu, habelə bu yundan toxunan parça.

3. Merinos yunundan hazırlanmış. *Merinos parça. Merinos şərf.*

**MERİYA** *is.* [*fr.*] İcra hakimiyyəti, bələdiyyə şurası.

**MERKANTİLİST** [*fr.* əsli *ital.*] Merkantilizm tərəfdarı.

**MERKANTİLÍZM** [*fr.* merkantilis, *ital.* merkante – ticarətdən] 1. XVI-XVIII əsrlərdə Avropada ticarət burjuaziyasının iqtisadi nəzəriyyə və siyasəti (bu nəzəriyyə ölkənin rifah halının istehsalın inkişafından deyil, əmtəə idxalının əmtəə ixracından üstünlüyündən və pul kapitalının toplanmasından asılı olduğu fikrinə əsaslanırdı).

2. *məc. kit.* Varlanmağa meyil, hər şeydə mənfəət güdmə.

**MESAJ** *is.* [*fr.*] Məktub, iltimas, xəbərdarlıq.

**MESENÁT** *is.* [*lat.*] Himayədarlıq edən, yardım göstərən.

**MÉSSA** *is.* [*fr.*] 1. Xristianlarda sübh və günorta ibadəti.

2. Dini məzmunda xor musiqisi.

**MESSO** *is.* [*ital.*] Musiqidə səs dinamikası.

**MEŞƏ** *is.* Çoxlu ağac bitmiş geniş sahə. *Palıd meşəsi. Şam meşəsi. – Meşə çaqqalsız olmaz.* (Məsəl). *Mən də meşə cığırı ilə boyumdan uca otların arası ilə evə hərəkət edirdim.* A.Divanbəyoğlu. *Kürün nəriltisi meşədə uğuldayırdı.* M.Hüseyn. // *məc.* Ağac kimi dikəlmiş çoxlu şey haqqında. *Gecə ay nur səpirkən buruqlar meşəsinə; Qulaq verdim ney çalan küləklərin səsinə.* Ə.Cəmil.

**MEŞƏARASI** *sif.* Meşənin içində və ya meşələrin arasında olan. *Meşəarası yol. – Onların ikisinin beş parçadan ibarət meşəarası zəmi yeri var.* S.Rəhimov.

**MEŞƏBƏYİ** *is.* Meşələrə nəzarət edən işçi. *Qəhrəman görmüşdü ki, meşəbəyi Rüstəm üçün nə qədər akt bağlamışdı.* S.Rəhimov. [Yusif:] *Mümkün eləsə, Daşdəmir meşəbəyindən bilet alsın, sovxoz üçün meşədən odun qırdırsın, özləri daşıyacaqlar.* B.Bayramov.

**MEŞƏBƏYİLİK** *is.* Təsərrüfat vahidi olan meşə sahəsi, habelə bu sahəyə nəzarət edən idarə. *Meşəbəyilikdə işləmək.* // Meşə təsərrüfatı idarəsinin yerləşdiyi təsərrüfat tikintiləri. *Meşəbəyiliyə getmək.*

**MEŞƏCİK** *is.* Balaca meşə, kiçik meşə. *Meşəciyi gəzmək.*

**MEŞƏCÜLLÜTÜ** *is. zool.* Təxminən göyərçin boyda nazik, uzun dimdik, gödəkayaq, bozumtul, zolaqlı lələkləri olan quş; çilikburun.

**MEŞƏÇİ** *is.* 1. Meşəçilik mütəxəssisi; meşəşünas.

2. Meşə qarovulçusu, meşə qoruqçusu.

**MEŞƏÇİLİK** *is.* 1. Meşə salmaq, becərmək və yetişdirmək haqqında elm; meşəşünaslıq. *Meşəçilik ədəbiyyatı.* – [Vəzirov] *..elmi-bioloji əsərləri isə Azərbaycan meşəçilik elminin yeni bir mərhələsinin əsasını qoyur.* Y.Qarayev.

2. Kənd təsərrüfatının bir sahəsi kimi meşəsalma; becərmə və ondan istifadə etmə. *Meşəçilik idarəsinin işçiləri maşından düşürtdükləri yekə mişarı götürüb Dədə palıda tərəf gedəndə Bağırın içində sanki nəsə qırıldı.* İ.Məlikzadə.

**MEŞƏ-ÇÖL** *is.* Meşə ilə çöl arasında keçid sahəsi.

**MEŞƏDOĞRAYAN** b a x **meşəqıran** 1-ci mənada.

**MEŞƏQIRAN** 1. *is.* Meşədə ağac kəsməklə məşğul olan fəhlə; meşədoğrayan. *Şəhərdə*

*bir qədər yaşadıqdan sonra, o, əhalisi meşəqıranlardan ibarət olan bir kəndə keçdi.* H.Seyidbəyli.

2. *sif.* Meşə qırmaq üçün olan, meşə qırmağa yarayan. *Meşəqıran maşın.*

**MEŞƏQIRMA** *is.* Meşədə ağac kəsmə işi. *Meşəqırma briqadası.*

**MEŞƏLƏNDİRMƏ** "Meşələndirmək"dən *f.is.*

**MEŞƏLƏNDİRMƏK** *f.* Meşə salmaq, bir sahədə ağaclar əkib meşə halına salmaq.

**MEŞƏLİ** *sif.* Meşə ilə örtülmüş, meşəsi olan. *Meşəli yaylaq. – Ehtiyat xala .. sıralanmış meşəli dağlar qoynunda, səfalı yaylaq şəhərində yaşayırdı.* Mir Cəlal.

**MEŞƏLİK** 1. *is.* Meşə olan yer, meşə ilə örtülmüş sahə. *Obamızın şimal tərəfi qərbdən-şərqə doğru uzanmış çılpaq qayalıq, daha sonra qalın bir meşəlikdi.* A.Şaiq. *Çıxır meşəlikdən talaya əlik; Səkir daşdan daşa xınalı kəklik.* M.Araz.

2. Bax **meşəli**. *Meşəlik yer.* – [Qız] *meşəlik yamacı göstərdi*. Çəmənzəminli.

**MEŞƏSALMA** *is.* Ağac əkib süni meşə becərmə. *Meşəsalma təsərrüfatı. Meşəsalma aylığı.*

**MEŞƏSİZ** *sif.* Meşəsi olmayan, ağacsız. *Meşəsiz sahə. Meşəsiz dağ yamacları. – Qovdular ceyranı meşəsiz dağa; Qoyun sürüləri doldu otlağa*. H.K.Sanılı.

**MEŞƏSİZLƏŞDİRİLMƏ** "Meşəsizləşdirilmək"dən *f.is.*

**MEŞƏSİZLƏŞDİRİLMƏK** *məch.* Meşələri qırılıb düzən hala salınmaq, meşəsiz hala salınmaq; ağacsızlaşdırılmaq.

**MEŞƏSİZLƏŞDİRMƏ** "Meşəsizləşdirmək"dən *f.is.*

**MEŞƏSİZLƏŞDİRMƏK** *f.* Meşələri qırıb düzən hala salmaq, meşələri qırmaq, meşəsiz hala salmaq; ağacsızlaşdırmaq.

**MEŞƏŞÜNAS** bax **meşəçi** 1-ci mənada. *Vəzirov .. bütün ömrü boyu həm yazıçı-dramaturq, həm də meşəşünas alim kimi öz ehtiras və enerjisini xalqın mənəvi və təbii sərvətlərinin mühafizəsinə həsr edir.* Y.Qarayev.

**MEŞƏŞÜNASLIQ** bax **meşəçilik** 1-ci mənada.

**MEŞİN** *is.* Aşılama yolu ilə hazırlanan ən sadə yumşaq qoyun və s. dərisi. // Həmin dəridən tikilmiş, hazırlanmış. [Ağasəfərin] *ayağında isə qara meşin çust vardı*. Ə.Əbülhəsən. *Siz ey meşin qapılar; Sizin üzünüz soyuq; Sizdən ümidlə girib; Ümidsiz çıxan da çox.* B.Vahabzadə.

**MEŞİNLİ** *sif.* Meşinlə örtülmüş, üzərinə meşin çəkilmiş. *Meşinli qapı*.

**MEŞMEŞİ** *is. məh*. Ərik.

**MEŞOK** [*rus.*] Kisə, torba. *..İndi məlum olur ki, siz biçarə avam camaatı yığırsınız başınıza, sonra ortalığa bir meşok pul qoyursunuz.* "Mol. Nəsr." *Qaraltı – dalında ağır bir meşok aparan gödək adam idi*. Mir Cəlal. *Həmzənin Hacı Tağı ilə oturduğu zirzəmi bir çox meşok və cürbəcür yeşiklərlə dolu idi*. Ə.Əbülhəsən.

**MEŞŞÁN** [*rus.* мещанин] 1. 1917-ci il inqilabından qabaqkı Rusiyada: xırda şəhər alverçilərindən, sənətkarlarından, aşağı vəzifəli qulluqçulardan və s. ibarət silk, təbəqə. // Həmin təbəqəyə mənsub olan adam. [Yakov] *kəndlilərin və meşşanların tabutlarını öz boyuna görə hazırladı.* A.Çexovdan.

2. *məc.* İctimai görüş dairəsi dar, xırda mülkiyyətçi əhvali-ruhiyyədə olan adam. [Bənövşə:] *Sən bizim gələcək həyatımızı bir meşşan həyatı kimi təsəvvür eləyirsən.* S.Rəhman.

**MEŞŞANCASINA** *zərf* Meşşan kimi, meşşana yaraşan bir tərzdə. *Meşşancasına yaşamaq*.

**MEŞŞANLAŞMA** "Meşşanlaşmaq"dan *f.is.*

**MEŞŞANLAŞMAQ** *f.* Meşşan xasiyyəti almaq, meşşan fikirli olmaq.

**MEŞŞANLIQ** *is.* Meşşanın psixologiyası və hal-hərəkəti. *Meşşanlıq etmək.*

**METÁL** [*lat.* metallum, əsli *yun*. metallon – mədən] İstiliyi və elektriki yaxşı keçirmə qabiliyyətinə malik olan, döyülüb yastılana bilən, spesifik parıltısı olan bəsit kimyəvi maddə (yaxud ərinti). *Əlvan metallar* (mis, nikel və b.). *Qara metallar* (dəmir, çuqun, polad və b.). *Nəcib metallar* (qızıl, gümüş, platin). // Həmin maddədən (yaxud ərintisindən) hazırlanmış. *Metal blok. Metal dirək.*

**METALAOXŞAR** *sif.* Zahirən metala bənzəyən, metal kimi olan.

**METALÇI** *is.* Metal sənayesi işçisi. *Şənlik və sevinc səslərini .. inşaatçılar, metalçılar şəhərində də eşitmək olardı.* Mir Cəlal. *Yarışır hər şaxtaçı, metalçı, neftçi fəhlə.* Ə.Cəmil.

**METALDOĞRAYAN** b a x **metalkəsən**.

**METAFİZİK**[1] *is.* [*yun.*] 1. Metafizik fəlsəfə tərəfdarı, metafizik üsul tətbiq edən (*dialektik* əksi).

2. Mücərrəd, anlaşılmaz, dumanlı fikirlər yürüdən adam haqqında.

**METAFİZİK**[2] *sif.* [*yun.*] 1. *fəls.* Metafizikaya əsaslanan, metafizikaya aid olan, dialektikaya zidd olan. *Metafizik fəlsəfə. Metafizik üsul.*

2. *məc.* Mücərrəd, anlaşılmaz, dumanlı. *Metafizik fikir*.

**METAFİZİKA** [*yun.*] 1. Dialektikanın əksinə olaraq, hadisələri, onların qarşılıqlı əlaqələri, ziddiyyətləri və inkişafı xaricində götürən idealist dünyagörüşü və dərketmə metodu.

2. Hər hansı bir mücərrəd, buna görə də aydın dərk edilməyən dumanlı şey haqqında.

**METÁFORA** [*yun.* metaphora – məcaz] *ədəb*. Bənzərliyə, oxşarlığa, analogiyaya əsasən söz və ya ifadənin məcazi mənada işlənməsi; məcaz.

**METAFORİK** [*yun.*] b a x **məcazi**.

**METALƏRİDƏN** *sif.* 1. Metal əritməklə məşğul olan. *Metaləridən zavod*.

2. *is.* Metaləridən fəhlə. *Bəzən Lətif işini qurtarıb qəlibçilər şöbəsinə gəlir, gözlük taxmış gənc metaləridənlərə .. sataşırdı.* H.Seyidbəyli.

**METALKƏSƏN** *sif.* Metalı kəsən, metalı kəsmək üçün olan. *Metalkəsən dəzgah.*

**METALLAŞDIRILMA** "Metallaşdırılmaq"dan *f.is.*

**METALLAŞDIRILMAQ** *məch.* Metaldan üz çəkilmək, metal təbəqəsi ilə örtülmək.

**METALLAŞDIRMA** "Metallaşdırmaq"dan *f.is.*

**METALLAŞDIRMAQ** *f.* Metaldan üz çəkmək, metal təbəqəsi ilə əritmək (bir şeyi).

**METALLI** *sif.* Metalı olan, tərkibində metal olan.

**METALLİK** *sif.* [*yun.*] Metaldan düzəldilmiş, metaldan olan; metal. *Metallik cisimlər.*

**METALLÚRGİYA** [*yun.* metallurgeo] 1. Ağır sənayenin, filizdən metal almaq və onun ilk emalı ilə məşğul olan sahəsi.

2. Metalların sənaye miqyasında istehsalı və onların ilkin emalı üsullarını öyrənən elm.

**METALLURJİ** *sif.* [*yun.*] Metallurgiyaya aid olan, metallurgiyaya məxsus.

**METALLURQ** [*yun.*] Metallurgiya mütəxəssisi.

**METALŞÜNAS** [*yun.* metallom və *fars.* ...şünas] Metalşünaslıq mütəxəssisi.

**METALŞÜNASLIQ** *is.* Metalların quruluşunu, xassələrini və onların dəyişmə qanunlarını öyrənən elm.

**METALYAYAN** *sif.* Metalı istilik və ya təzyiq altında yayan, yastıladan. *Metalyayan dəzgah*.

**METAMORFÓZ** *is.* [*yun.*] Şəklini dəyişmə, başqa şəklə salma, çevirmə.

**METÁN** [*fr.* methane] Karbonla hidrogenin birləşməsindən ibarət rəngsiz qaz.

**METASTÁZ** [*yun.* metastasis – yerdəyişmə] *tib*. Xəstəlik törədicisinin, xəstəlik mənbəyinin törəmiş olduğu yerdən bədənin başqa yerlərinə yayılması, keçməsi, habelə xəstəliyin belə bir yerdəyişmə nəticəsində əmələ gələn ikinci mənbəyi.

**METATEZA** [*yun.* metathesis – yerdəyişmə] *dilç.* b a x **yerdəyişmə** 2-ci mənada.

**METEÓR** [*yun.*] Yer atmosferində sürətlə hərəkət edən kosmik mənşəli qızmar cisim. [Nuriyyə:] *Nə üçün bizim taleyimizdə səadət bəzən bir meteor kimi parlayıb qeyb olur?* İ.Əfəndiyev. [Firəngiz] .. *aydın yollu kəhkəşana, hərdən axıb gedən .. meteora baxdı*. B.Bayramov.

**METEORÍT** [*yun.* meteoros] Planetlərarası boşluqlardan Yer səthinə düşən kosmik mənşəli cisim. *Meteoritlər kosmik fəzadan Yerin səthinə düşən yeganə cisimlərdir.*

**METEOROLÓGİYA** [*yun.* meteora – atmosfer hadisəsi və logos – elm] 1. Yer atmosferi, onun quruluşu, xüsusiyyətləri və onda baş verən fiziki proseslər haqqında elm.

2. Hava və onun necə olacağı haqqında qabaqcadan xəbər verilməsi üsulları haqqında elm.

**METEOROLOJİ** *sif.* Meteorologiyaya aid olan. *Meteoroloji tədqiqat.* – [Rəis:] *Bu gün*

*meteoroloji stansiya xəbər verdi ki, bərk yağıntı gözlənilir.* İ.Əfəndiyev.

**METEORÓLOQ** [*yun.*] Meteorologiya mütəxəssisi. *Meteoroloqlar çoxdan bilirlər ki, yağışın əmələ gəlməsi üçün heç də təkcə su lazım deyildir.*

**METİL** [*fr.* methule] *kim.* Bir sıra üzvi birləşmələrin tərkibinə daxil olan bir karbon atomundan və üç hidrogen atomundan ibarət qrup.

**METİS** [*fr.*] 1. Cütləşdirmə nəticəsində alınan heyvan və ya bitki.

2. Müxtəlif insan irqləri nümayəndələrinin biri-birilə evlənməsindən törəyən nəsil.

**MÉTOD** [*yun.*] Təbiət və ictimai həyat hadisələrini dərk və tədqiq etmə üsulu. *Dialektik metod. Müqayisəli metod.* // Ümumiyyətlə üsul, üsullar sistemi.

**METODİK** *sif.* 1. Metodikaya aid olan, metodikaya müvafiq olan; bir şeyi yerinə yetirmə üsul və yollarını göstərən. *Metodik vəsait. Metodik təlimat.*

2. Müəyyən plana tam uyğun; ardıcıl, müntəzəm.

**METODİKA** [*yun.* methodike] 1. Bir şeyin əməli surətdə icrası üçün metodlar, üsullar məcmusu. *Elmi tədqiqlərin metodikası.*

2. Müəyyən elmin tədris üsulları haqqında nəzəriyyə. *Dil metodikası.*

**METODİKİ** bax **metodik** 1-ci mənada. *Metodiki kömək.*

**METODİST** [*yun.*] Hər hansı bir fənnin tədrisi metodikası mütəxəssisi.

**METODOLÓGİYA** [*yun.* methodos və logos] Ümumiyyətlə, elmi metod və ayrı-ayrı elmlərin metodları haqqında təlim.

**METODOLOJÍ** *sif.* Metodologiyaya aid olan, metodologiya ilə əlaqədar olan. *Metodoloji səhv.*

**METODÓLOQ** [*yun.*] Metodologiya mütəxəssisi.

**METÓL** *is.* [*yun.*] Rəngsiz üzvi kristal maddə.

**MÉTON** *is.* [*xüs. is.*-dən] Günəş-Ay təqvimində zaman intervalı.

**METONİMİYA** [*yun.* metonymia – adını dəyişmə] *ədəb.* Bir sözün, iki məfhumun bir-birinə yaxınlığına əsasən başqa sözlə əvəz edilməsindən ibarət ifadə üsulu; məcaz (məs.: "ağıl" əvəzinə "baş", "Sabirin əsərlərini oxumaq" əvəzinə "Sabiri oxumaq"), habelə bu cür işlədilmiş söz və ya ifadə.

**METR** [*yun.* metron – ölçü] 1. Metr ölçü sistemində yüz santimetrə bərabər uzunluq.

2. Santimetrlərə bölünmüş bu uzunluqda ölçü aləti.

...**metr** [*yun.* metron – ölçü] Xarici mürəkkəb sözlərin ikinci tərkib hissəsi olub, aşağıdakı mənaları ifadə edir: a) sözün birinci hissəsində ifadə olunmuş ölçünün uzunluğunu bildirir; məs.: kilometr, santimetr, millimetr; b) sözün birinci hissəsində ifadə olunanı ölçmək üçün cihazı, aləti bildirir; məs.: voltmetr, termometr.

**METRÁJ** [*fr.* metrage] 1. Bir şeyin metrlə uzunluğu. *Kinolentinin metrajı.*

2. Otağın və s.-nin kvadrat metrlə sahəsi. *Otağın metrajı.*

**METRANPÁJ** [*fr.* metteur en pages] Yığılmış mətnləri səhifələyən mətbəə işçisi.

**METRİK** *sif.*: **metrik ölçü sistemi** – əsası metr olan beynəlxalq ölçü vahidi sistemi.

**MÉTRİKA** [*lat.*] Doğum şəhadətnaməsi.

**METRÓ** [*fr.*] "Metropoliten" sözünün qısaldılmış forması. *Bakı metrosu. – Metro vaqonunda oturanlardan biri, qabağında ayaq üstündə durmuş qocadan soruşur.* M.Hüseyn.

**METROPOLİTÉN** [*fr.* metropolitain] Yeraltı şəhər elektrik dəmir yolu. *Bakı metropoliteni.*

**MEY** *is.* [*fars.*] Şərab. *Hər nə etsən, et və lakin etmə meydən ictinab; Hər nə tutsan, tut və lakin tutma bir kari-səvab.* M.Ə.Sabir. *Dostlar içib gözləri süzülü qaldı; Turş meydən dodaqları büzülü qaldı.* M.Müşfiq.

**MEYDAN** *is.* [*fars.*] 1. Şəhər və ya kənd, qəsəbə və s. içərisində tikilisiz açıq və geniş düz yer, sahə. *Bakıda Azneft meydanı. – Yavaş-yavaş gəlib bir böyük meydana yetişdik.* Ə.Haqverdiyev. *Çatıb kəndin meydanına düşdük atlardan; Kənd axışdı yanımıza keçmədi bir an.* S.Rüstəm.

2. Ümumiyyətlə, düz və geniş sahə; düzənlik, genişlik. *Dağın o tərəfi böyük meydandır.*

3. Bir işin icrası üçün geniş sahə, yer. *Vuruş meydanı. Döyüş meydanı. Təlim meydanı.* – [Koroğlu:] *Yağı düşmənin hərbəsi; Qaçırtmaz meydandan məni.* "Koroğlu".

*Gənclərin gücü ilə bir neçə dəfə iməcilik keçirilib, idman meydanı düzəldi.* Ə.Sadıq.

4. Obrazlı təşbehlərdə: “geniş”, “enli” mənasında. *Əyilməyib, düzdür onun uca qaməti; Sinə meydan, kürək enli, görkəmi dağdır.* Ə.Əlibəyli.

5. Yerlik halda: **meydanda** – ortada, arada, aralıqda. *Meydanda bir səbəb yoxdur. Lazım olan şeylərin heç biri hələ meydanda yoxdur.* // Yönlük halda: **meydana** – ortaya, araya, aralığa. *Bəli, bizlərdə övrəti boşamaq lazım olanda həmişə meydana bir bəhanə gəlir.* C.Məmmədquluzadə. // Yerlik halda xəbər şəkilçisi ilə: **meydandadır** – aşkardır, göz önündədir, hamı görür. *Onun gördüyü işlər hamısı meydandadır.*

6. *məc.* Fürsət, imkan; əlverişli şərait. *Mahi-ramazandır, yenə meydan da bizimdir! Meydan da bizim, ərsədə cövlan da bizimdir?* M.Ə.Sabir. *Bir qız ilən bir gəlinin bəhsi var; Gəlin deyər: – Bu gün meydan məndədir.* Aşıq Valeh.

◊ **Meydan açmaq** – mübarizəyə çağırmaq, döyüşə hazır olmaq, döyüşə girişmək. *Minincə öz Qıratına; Meydan açar əsən yelə.* A.Şaiq. *Qəhrəmanım gülümsədi, qüvvət gəldi qəlbinə; Dalğalara sinə gərdi, meydan açdı o yenə.* S.Vurğun. **Meydan demək** – b a x **meydan oxumaq**. *Meydan deyir qaranlığa; Dayanmadan bir anlığa.* S.Vurğun. **Meydan düzəltmək** – b a x **meydan qurmaq**. [Xəlfə:] *Gəlin aşaq dağ ardına, orda meydan düzəldək, qoy gəlin-qız burda çalıb-oynasın.* C.Cabbarlı. **Meydan günü** – imtahan, sınaq vaxtı, yoxlama zamanı. *Ölənədək dönə bilməz yarından; Meydan günü başın qoyar can ilə.* M.V.Vidadi. **Meydan qurmaq** – toplaşmaq, bir yerə yığılmaq. *Meydan quraq, söhbət açaq, saz tutaq; Gül yanaqda qoşa xaldan danışaq.* S.Vurğun. **Meydan oxumaq** – müharibəyə, döyüşə, mübarizəyə çağırmaq, hədələmək. *At oynatdı kuyində hər cahangir bir kərə; Ərəb meydan oxudu şövkətli qeysərlərə.* Ə.Cavad. [Altunbay:] *Mən bütün dünyaya meydan oxuyan bir qüvvətə qarşı dura bilmərəm.* C.Cabbarlı. **Meydan sulamaq** – hökmranlıq etmək, özünü hökmran kimi aparmaq, mənəm-mənəm demək. *Ağacın dibində qanadlarını açıb meydan sulayan çil-çil xoruzu* [Qaraş] *qovdu.* M.İbrahimov. *Cəmiyyətlə şəxsiyyət arasında hər cür ziddiyyətin silinib yox olduğu bir dövrdə Kərəmov meydan sulaya bilməzdi.* İ.Əfəndiyev. **Meydan tutmaq** – çaşmaq, karıxmaq, özünü itirmək, nə edəcəyini bilməmək. *Silanın qəlbi alovlandı. Onu meydan tutdu.* S.Vəliyev. **Meydan vermək** – imkan vermək, mane olmamaq, yol vermək, kömək etmək. [Bəhram:] *Yox, verilməz buna meydan; Sarayın öz qanunu var.* A.Şaiq. [Firəngiz Cəbrayıla:] *Biz* [Musaya] *öz fikrini deməyə nə vaxt meydan vermişik?* B.Bayramov. **Meydana atılmaq** – özünü qabağa vermək, irəli atılmaq. *Bizim .. qırxayaq* (*xərçəng*) *kimi geri getməyimizin ümdə səbəbi bizim bilamülahizə fikir meydana atıb yalançı pəhləvan kimi oyun çıxartmağımızdır.* Ü.Hacıbəyov. **Meydana atmaq** – aşkara çıxarmaq, aşkar etmək, hamıya bildirmək. **Meydana buyur (buyur meydana)** – döyüşə, vuruşa və ya mübahisəyə dəvət. [Şah:] *Sən bədəfkar və xəbis cəlladsan; Qorxmuram səndən, buyur meydana sən.* Ü.Hacıbəyov. **Meydana çıxartmaq** – aşkar etmək, göstərmək. *Bizim mollalarımız bu iki ilin müddətində, guya ki, bir özgə şəriət meydana çıxarıblar.* C.Məmmədquluzadə. “*Həyat*” *Mirzədə güclü dramaturqluq istedadının olduğunu meydana çıxartdı.* S.Rəhman. **Meydana çıxmaq** – aşkar olmaq, zahirə çıxmaq, ortada görünmək. ..*Əgər xanım qızlar kişi kimi meydana çıxmasalar, vətən övladının gələcəyə arxayın olmağı çətindir.* C.Məmmədquluzadə. *Niyə nuri-həqiqət çıxmayır meydanə bilməm ki..* M.Hadi. **Meydana gəlmək** – 1) mübahisə, mübarizə meydanına daxil olmaq. *Bircə nolaydı gələ meydanıma; Ta ki, düşə gözləri cövlanıma.* S.Ə.Şirvani. *Sədd çəkildi dörd yana; Ağ at gəldi meydana.* S.Vurğun; 2) ortaya çıxmaq. *Hamamdan gələndən sonra bəyin başı qırxılmaq məsələsi meydana gəlir.* R.Əfəndiyev. **Meydana qoymaq (çəkmək)** – ortaya çıxarmaq, üzə çıxarmaq, zahir etmək, açmaq, bildirmək. *Məsələni meydana qoymaq. – Təlxəklər bütün kələklərini meydana qoydular.* Çəmənzəminli. **Meydanda olmaq** – zahirdə, aşkarda olmaq, göz önündə olmaq. **Meydanda tək qalmaq** – köməksiz olmaq,

təkbaşına qalmaq. *Bu dəmdə Xəlilə kənardan tamaşa edən olsaydı, onu meydanda tək qalmış və ümidsizlikdən qəddi bükülmüş bir igidə bənzədərdi.* M.Hüseyn. **Meydandan qaçmaq** – axıra qədər bir işi davam etdirməmək, dala çəkilmək, qorxmaq. *Meydandan qaçana namus, ar olsun!* "Koroğlu". **Meydanı boş (xali) görmək** – heç bir maneənin olmamasından istifadə etmək, istədiyini edə bilmək. *Meydanı boş görmüsən? – Gördü meydanı adamdan xali; Hərə bir əzmə şitaban oldu.* M.Ə.Sabir. **Meydanı daralmaq** – işlənmə sahəsi azalmaq, məhdudlaşmaq. *..Ərəb* [əlifbasının] *meydanı gündən-günə daralmaqdadır.* F.Ağazadə.

**MEYDANÇA** [*fars.*] 1. Balaca meydan, kiçik meydan. *Meydançaya kölgə salır; Çadır kimi göy buludlar.* N.Rəfibəyli. *Bulvarın Bayıla tərəf uzadılmış təzə hissəsi ürəkaçan, səfalı bir meydançaya çevrilmişdi.* H.Seyidbəyli. // Bir iş görmək üçün açıq sahə. *Tikinti meydançası.*

2. Bir tikilinin, binanın və s. üstündə və ya içərisində düz boş yer. *Pilləkən meydançası. – Məbəd taxta qüllədən ibarət idi. Yuxarısında kiçik bir meydança var idi.* Çəmənzəminli.

**MEYDANLIQ** *is.* Açıq yer, açıqlıq, düzənlik, meydan.

**MEYGƏDƏ** *is.* [*fars.*] *klas.* bax **meyxana**[1]. *Zinhar girmə məscidə, bihürmət olma, leyk; Var, payitəxti-meygədədə ehtiram bul.* Q.Zakir.

**MEYXANA**[1] *is.* [*fars.*] *köhn.* Şərab satılan və içilən dükan, şərabçı dükanı. *..Konsulxana fərraşı meyxananın qapısında kefli və əlində çaxırla dolu stəkan mənim qabağımı kəsib məndən dörd manat istədi.* C.Məmmədquluzadə.

**MEYXANA**[2] *is.* [*fars.*] Fikirləşmədən, qabaqcadan hazırlaşmadan deyilən, adətən məzhəkəli şeir növü. *Adamlar dağılandan sonra toy sahibinin yaxın adamları qalıb meyxana deyərdilər.* H.Sarabski. [Dursun:] *İlyasgili qapıları bağlayıb meyxana deyirlər.* C.Cabbarlı.

**MEYXANAÇI**[1] *is. köhn.* Meyxana sahibi, meyxana saxlayan adam.

**MEYXANAÇI**[2] *is.* Məclislərdə meyxana deyən, meyxana deyişmələrində iştirak edən adam. [Şəki toylarında] *xan oyunu çıxar, meyxanaçılar meyxana deyişərlər, bəzən də aşıq gətirdib nağıl danışdırarlar.* R.Əfəndiyev.

**MEYXANAÇILIQ**[1] *is. köhn.* Meyxana saxlama işi.

**MEYXANAÇILIQ**[2] *is.* Meyxana demə işi. *Meyxanaçılıq eləmək.*

**MEYXOŞ** *sif.* [*fars.*] 1. Turş ilə şirin arasında orta dad; turşaşirin. *Meyxoş nar.*

2. *məc.* Xoşagələn, xoş. *Muğandan keçirəm, meyxoşdur bahar; Ömrü az olsa da burdakı yazın.* S.Vurğun.

**MEYXOŞLUQ** *is.* Meyxoş şeyin xassəsi, keyfiyyəti; turşaşirinlik.

**MEYİL** *is.* [*ər.*] 1. Bir tərəfə əyilmə. *Divarın meyli bayıradır.* ☐ **Meyil etmək (eləmək)** – 1) əyilmək; 2) istiqamət almaq, yönəlmək. *Məşədibəy isə adamları yarıb arvadını görməyə meyil etdiyi halda birdən dayandı.* M.Hüseyn. *Səfər kişi irəliyə tərəf meyil elədi.* Mir Cəlal.

2. İstək, arzu, həvəs. *Uşağın oynamağa meyli yoxdur. Tələbənin ədəbiyyata meyli var. – Dedi: – Həmsayə! Var nəyə meylin; Nə yeyirsən, nə istəyir könlün?* M.Ə.Sabir. ☐ **Meyil göstərmək** – həvəs göstərmək, rəğbət etmək. *Üç-dörd günün müddətində haman müntəxib olunan kəslər göründü və hamısı şurişə meyil və amadəlik göstərdilər.* M.F.Axundzadə. *Əcnəbilərin içində övrət sahibi bir kişinin özgə övrətə meyil göstərməyi şiddətli təqsir hesab olunur.* C.Məmmədquluzadə. **Meyil qılmaq (etmək)** – arzulamaq, istəmək, könül bağlamaq. *Bir kimsəyə xurşid camalın ola mənzur; Mehri-fələkə meyil qılıb ayə baxarmı?* Q.Zakir. **Meyil salmaq** – bir şeyə həvəs göstərmək. **Meyildən düşmək** – daha həvəsi olmamaq, istəməmək. **Meyli düşmək** – istəmək, bəyənmək, xoşlamaq. **Meyli çəkmək** – istəmək, ürəyindən keçirmək. **Meyli olmaq** – həvəsi olmaq, istəmək. *Dedi: – Meylin olurmu aluyə; Təmi meyxoş qızıl gəvaluyə?* M.Ə.Sabir. *Gər meylim ola şəmi-rüxi-yarə, nə nöqsan; Adətdi ki, pərvanə edər narə məhəbbət.* S.Ə.Şirvani. [Zeynalın] *Mehribana bu qədər meyli olduğu görülməmişdi.* S.Hüseyn.

3. Könül, məhəbbət. *Mən sənə mailəm, səndədir meylim; Demə səndən qeyri kəsdədir, ay qız!* M.P.Vaqif. [Sitarə:] *Özüm cavan*

*qızam, həm də var sənə meylim*. C.Cabbarlı. *Səltənət atasının Şahpəriyə olan meylini bilirdi.* B.Bayramov. **Meyil salmaq** – sevmək, istəmək, könül bağlamaq. *Bir ildən artıqdır ki,* [Gülşən] *özü də bilmədən Eyvaza meyil salmışdı.* Ə.Vəliyev. **Meyli düşmək** – b a x **meyil salmaq**. *Mən aşiq, neylim sənə; Düşübdür meylim sənə; Mən dönsəm, üzüm dönsün; Sən dönsən, neylim sənə?* (Bayatı).

**MEYİLLƏNMƏ** "Meyillənmək"dən *f.is. Temperatur əqrəbinin meyillənməsi*.

**MEYİLLƏNMƏK** *f.* 1. Bir tərəfə meyil etmək, yana doğru əyilmək. *Sütun getdikcə sol tərəfə meyillənir. – Qoşqar bir uşaq səmimiyyətilə irəli meyilləndi.* İ.Hüseynov.

2. Meyil göstərmək, həvəs göstərmək.

**MEYİLLİ** *sif.* 1. Bir tərəfə, bir yana meyil edən, əyilən.

2. Bir şeyə meyli, həvəsi olan, meyil göstərən; mayil.

**MEYİLSİZ** *sif.* və *zərf* Meyli, həvəsi olmayan; meyil, həvəs göstərməyən; meyilsiz, həvəssiz, istəksiz. *İşə meyilsiz yanaşmaq.*

**MEYİLSİZCƏ** *zərf* Meyli olmadan, istəməyərək; həvəssiz. *Uzun dağ yolunu meyilsizcə addımlayan acmış at sanki bir cənazə sürüyürdü.* Mir Cəlal.

**MEYİLSİZLİK** *is.* Meyil, həvəs olmama; həvəssizlik.

**MEYİT** *is.* [*ər.*] Ölmüş adam; cənazə, nəş. *Meyiti basdırmaq. – Bir azdan sonra* [Hacı Nəsirin] *meyitini evə gətirdilər.* S.S.Axundov.

**MEYİTXANA** *is.* [*ər.* meyyit və *fars.* ...xanə] Xəstəxanada meyit saxlanılan yer.

**MEYİTSİFƏT** *sif.* [*ər.*] Sifətinin rəngi solğun, saralmış olan. *Ata tərəfdən qohumu olan bu meyitsifət, solğun adamdan Qadirin zəhləsi gedirdi.* Ə.Əbülhəsən.

**MEYMUN** *is.* 1. *zool.* Bədən quruluşuna görə insana yaxın olan məməli heyvan.

2. *məc.* Çox çirkin adam haqqında. *Lap meymundur.*

3. *məc.* Başqalarını yamsılayan, təqlidini çıxardan adam haqqında.

**MEYMUNABƏNZƏR, MEYMUNAOXŞAR** *sif.* Zahiri görünüş və bədən quruluşu cəhətdən meymuna bənzəyən.

**MEYMUNLUQ** *is. dan.* Təqlidçilik, yamsılama, başqalarının təqlidini çıxarma. □ **Meymunluq etmək** – təqlid etmək, yamsılamaq, oyun çıxarmaq. *Nə meymunluq edirsən?*

**MEYMUNOYNADAN** *is.* 1. Keçmişdə meymun gəzdirib tamaşa göstərən adam. *Səhnənin sağ tərəfindən meymunoynadanın səsi eşidilir.* Ə.Haqverdiyev.

2. *məc.* Masqaraçı, adamdolayan, adamoynadan.

**MEYNƏ** *is. məc.* Üzüm tənəyi. *Meynə əkmək. Meynələrin başını vurmaq. – Meynələrində qora; İlişdim, düşdüm tora.* (Bayatı). *İllər keçər, bu meynə qumların üzərində; Günəşdən qüvvət alıb artar, qol-budaq atar*. S.Rüstəm.

**MEYNƏQURDU** *is. zool.* Meynələrə ziyan verən cücü, qurd.

**MEYNƏLİK** *is.* Meynə əkilmiş sahə, üzüm bağı; üzümlük. *Meynəliyi becərmək.* – [Xədicə] *üzüm dərmək üçün meynəliyə doğru getdi.* S.Hüseyn.

**MEYÓZ** *is.* [*yun.*] Reduksion bölünmə, yetişkənlik bölünməsi.

**MEYRULU** *is. bot.* Salxımı normal tozlanmamış, xırda, toxumsuz üzüm giləsi və salxımın özü. *Ağ şanının meyrulusu. – Bir çox hallarda üzüm salxımlarında normal inkişaf etmiş və içərisində çəyirdəyi olan iri meyvələrdən başqa, xırda və toxumsuz meyvələr də olur. Onlara meyrulu deyilir.* M.Qasımov.

**MEYVƏ** *is.* [*fars.*] 1. Bəzi ağacların, kolların yeməli, şirəli məhsulu. *Cır meyvə. Kol meyvəsi*.

2. *məc.* Məhsul, bəhər, nəticə. *Əməyinin meyvəsini görmək. – Eşqin meyvəsidir hər yeni dastan*. S.Vurğun. *Elə bil oynayan adi bir Azərbaycan qızı deyil, yerə enmiş və yalnız insan xəyalının meyvəsi olan bir mələk idi.* M.Hüseyn.

**MEYVƏCAT** *top.* [*fars.* meyvə və *ər.* ...at] Müxtəlif meyvələr. *Meyvəcat dükanı.* – [Murad] *hər axşam evə qayıdarkən* [Nigarı] *küçədə, səki üstündə yaş meyvəcat satmaqla məşğul olan atası Ağabalanın yanında görərdi.* S.Hüseyn. *..Tərəvəz, meyvəcat, küpküp şərab gəmiyə yükləndi.* M.Rzaquluzadə.

**MEYVƏÇİ** *is.* Meyvə ağacları əkib-becərməklə məşğul olan adam; meyvəçilik mütəxəssisi; bağban.

**MEYVƏÇİLİK** *is.* Meyvə ağacları, meyvə bitkiləri əkib becərmə işi; bağçılıq. *Meyvəçilik briqadası.* – [Almaz:] *Mən deyirəm: bağ meyvəçilik üçün alınsın.* C.Cabbarlı.

**MEYVƏQURUDAN** *is. xüs.* Meyvə qurutmağa məxsus maşın və s. // Sif. mənasında. *Meyvəqurudan sex.*

**MEYVƏLƏNMƏ** "Meyvələnmək"dən *f.is.*

**MEYVƏLƏNMƏK** *f.* Bar gətirmək, barlanmaq, məhsul gətirmək. *Ağaclar meyvələndi.*

**MEYVƏLİ** *sif.* 1. Meyvəsi olan, meyvə verən, meyvə gətirən. *Meyvəli ağac.*

2. Məhsuldar, bəhrəli, çox meyvə verən. *Meyvəli bağ. – Hamı təzədən bağçalarını güllü, ağaclarını meyvəli, tarlalarını məhsullu görmək istədi.* Ə.Məmmədxanlı.

**MEYVƏLİK** *is.* Meyvə ağacları olan yer, meyvə bağı. *Meyvəliyi becərmək. – ..Çiçəyini təzə tökmüş yaşıl ipək yarpaqlı meyvəliklərdə dizinəcən çirməkli dirrikçilər lək düzəldirdilər.* Mir Cəlal.

**MEYVƏSİZ** *sif.* Meyvəsi olmayan, meyvə gətirməyən; məhsulsuz, bəhrəsiz, meyvə verməyən, bar verməyən. *Meyvəsiz ağac. – Bir meyvəsiz cır ağaca! Bar gətirən calaq vurur.* N.Rəfibəyli.

**MEYVƏSİZLİK** *is.* Meyvə verməyən ağacın, kolun halı; barsızlıq.

**MEYVƏYETİRİCİ** *sif.* Münbit, bərəkətli, məhsuldar. *..Bu sayaq barverici və meyvəyetirici torpağın əhalisi əgər elmli və bilikli olsa idi, əlbəttə, ehtiyacdan xəbərləri olmazdı.* F.Köçərli.

**MEZON** *is.* [*yun.*] Sükunət kütləsi.

**MƏAL** *is.* [*ər.*] *klas.* Bir yazı və ya söz ilə anladılmaq istənilən fikir, məna. *Beytin məalı.*

**MƏBADA** *əd.* [*fars.*] Birini bir işdən, hərəkətdən saqındırmaq, çəkindirmək üçün işlədilən söz (bəzən qoşa işlənir); olmaya, olmaya-olmaya, etmə, saqın. *Məbada onunla yoldaşlıq edəsən! Məbada gedəsən. – Fəqanə gəlmə, könül, çəkdi yar şəmşirin; Məbada əl çəkə qətlindən iztirabı görüb.* S.Ə.Şirvani. *..Xudayar bəy Zeynəbin yanına adam göndərdi ki, məbada-məbada özgəsinə dil verə və özgəsinə ərə gedə.* C.Məmmədquluzadə.

**MƏBƏD** *is.* [*ər.*] 1. İbadətgah, ibadət yeri (hansı dində olursa olsun). *Misir məbədləri. Məbəddə ibadət etmək.*

2. *məc.* Dərin hörmət bəslənilən yer. *Elm məbədi. İncəsənət məbədi. –* [Oqtay:] *Teatra bir məktəb bəlkə də demək olur. Fəqət bir sənət məbədi kimi o daha yüksəkdir.* C.Cabbarlı.

**MƏBƏDGAH** [*ər.* məbəd və *fars.* ...gah] b a x **məbəd**. *Bizdən yuxarı dağın şəhərə enən tərəfində müqəddəs Davudun məbədgahı da vardır.* C.Məmmədquluzadə.

**MƏBHUT** *zərf* [*ər.*] Heyran-heyran, çaşmış halda, heyrət içində. *..Qatar yola düşdü və mən də məbhut onun gözdən itənədək dalınca baxdım.* Ə.Haqverdiyev. ☐ **Məbhut qalmaq** – heyran qalmaq, təəccüblənmək, çaşıb qalmaq. [Dərviş:] *Ox dəymiş şir kimi saçlarımı silkələyib, başımı yuxarı qaldırıb, məbhut bir halda qaldım.* A.Divanbəyoğlu. *..Şəfiqənin mərmər kimi ay üzündə olan çökəklərini gördükdə Cəlil ağa məbhut qaldı və birdən-birə onu sevdi, aşiq oldu.* Q.İlkin. **Məbhut etmək** – heyran etmək, heyrətdə qoymaq, təəccübləndirmək. *Onların arasındakı intizam və başçılarına olan hörmət bizi məbhut etmişdi.* M.İbrahimov. **Məbhut olmaq** – b a x **məbhut qalmaq**. *Firidun maşından düşüb, göz işlədikcə uzanan bağa, güllüklərə və imarətlərə baxdıqda məbhut olub qaldı.* M.İbrahimov.

**MƏBLƏĞ** *is.* [*ər.*] Miqdar (pul haqqında). *Pulun məbləği. –* [Allahqulu:] *Bu gündən həmin məbləğə on iki saat işləyəcəksiniz.* S.S.Axundov. // Pul. [Hakimi-şər:] *Onu xəbərdar elə ki, iki saatdan sonra Hacı Qafurdan qalan məbləği mən özüm ona təslim edərəm.* M.F.Axundzadə. [Xortdan:] *Ağır miqdarda məbləğ cəm edib, Məşədiyə vüsul oldu.* Ə.Haqverdiyev.

**MƏBUD** *is.* [*ər.*] İbadət, sitayiş edilən şey (Allah, büt, ay, gün, ulduz və s.). *Məbudinə ərz qıldı razın; Bildirdi könüldəki niyazın.* Füzuli. *Düşüb səcdəyə qıldı əvvəl namaz; O, məbudinə etdi razü niyaz.* M.Ə.Sabir.

**MƏCAZ** *is.* [*ər.*] *ədəb.* Həqiqi mənasında işlənməyib, oxşarlığı və münasibəti olan başqa bir mənaya oxşadılaraq işlənən söz və ya ifadə; metafora. *Şeirdə işlədilən məcazlar. Yazıçı məcazları çox işlədir.*

**MƏCAZİ** *sif.* [*ər.*] *ədəb.* Həqiqi, hərfi mənada deyil, metaforik mənada işlənən; metaforik. *Məcazi məna.*

**MƏCAZİLİK** *is.* Məcazi mənada işlənmə, məcazi olma. *Mənanın məcaziliyi.*

**MƏCBUR** *sif.* [*ər.*] Zorla bir işə sövq olunan, zorla bir işi görməli olan; naçar. [Yusif Sərrac:] *..Mən məcburəm ki, səltənətdən əl çəkib taxtü tacı bir kimsənəyə vagüzar edim.* M.F.Axundzadə. *Tərk etməyə amalını aləm hamı məcbur.* A.Səhhət. ☐ **Məcbur etmək** – vadar etmək, zorla bir işi gördürmək. [Xədicə:] *Hər kəsi özü ilə hesablaşmağı məcbur edərdi.* S.Hüseyn. [Sevinc Mahmuda:] *Səni məktəbdən qaçmağa məcbur edən tənbəllikdir.* Z.Xəlil. **Məcbur qalmaq** – b a x **məcbur olmaq**. *Mənzil başına çatmadan tramvaydan düşməyə məcbur qaldım.* Qantəmir. **Məcbur olmaq** – vadar olmaq, əlacsız qalaraq bir işi görməli olmaq, bir işi məcburən görmək. [Qız:] *Bəlkə Şirmayı anasından qorxub həqiqəti gizlətməyə məcbur olmuşdur?* M.Hüseyn. *Ataş öz ata yurduna qaçmağa məcbur olmuşdu.* Ə.Vəliyev.

**MƏCBURƏN** *zərf* [*ər.*] 1. Məcbur olaraq, məcburiyyət altında, zorla, könülsüz olaraq. *Fəxrəddin məcburən qapının aslan başından ibarət olan .. çaxçaxını qorxa-qorxa vurdu.* M.S.Ordubadi.

2. Mütləq, necə olursa olsun. *Sabah məcburən gəlməlisən.*

**MƏCBURİ** *sif.* [*ər.*] Şərtsiz olaraq yerinə yetirilməli, qanunən tələb olunan. *Məcburi şərtlər. Qərar hamı üçün məcburidir. Məcburi surətdə.*

**MƏCBURİYYƏT** *is.* [*ər.*] Məcburluq, məcbur olma, zor, güc. *Evlənmək istəyən bir qədər peşkəş özü ilə gətirib, bəyin qulluğuna gedib ondan izin almaq məcburiyyətində idi.* Ə.Haqverdiyev. *Camalı tanıya bilmədiklərini etiraf etmək məcburiyyətində qalan Bülənd .. Nəcmiyə baxdı.* Ə.Əbülhəsən.

**MƏCBURLUQ** b a x **məcburiyyət**.

**MƏCCANƏN** *zərf* Məccani olaraq; pulsuz, müftə (olaraq).

**MƏCCANİ** *sif.* və *zərf* [*ər.*] Müftə, pulsuz, havayı. *Məccani bilet. Məccani tamaşa.* – *..Füqəraları məccani müalicə edir.* N.Vəzirov. *Uşaqlarının məccani oxuduğunu da Hüseynə Mirmahmud xəbər vermişdi.* S.Rəhman.

**MƏCƏLLƏ** *is.* [*ər.*] 1. Hüququn hər hansı bir sahəsinə aid sistemə salınmış qanunlar toplusu. *Mülki məcəllə. Cinayət məcəlləsi. Səhiyyə qanunları məcəlləsi.*

2. *köhn.* Məcmuə, kitab, risalə. [Səttarxan:] *Mən bir ruznamə və ya məcəllə çıxarılmasını istəyirəm..* P.Makulu.

**MƏCHUL** *sif.* [*ər.*] 1. Bilinməyən, naməlum (*məlum* əksi). [Xədicə] *hərəkətsiz gözlərini məchul bir nöqtəyə dirəyib baxırdı.* S.Hüseyn. *Çünki bəşər daima uçduqca uçmaq istər; Hər gün yeni və məchul bir qapı açmaq istər.* M.Müşfiq.

2. *riyaz.* Məlum olmayan, axtarılan. *Məchul kəmiyyət.*

◊ **Məchul feil** *qram.* – hərəkətin həqiqi icraçısı zahirdə olmayan feil.

**MƏCHULLU** b a x **məchul** 2-ci mənada. *Məchullu tənlik.*

**MƏCHULLUQ** *is.* Naməlumluq; bilinməmə, məchul olma.

**MƏCLİS** *is.* [*ər.*] 1. Bir məsələ haqqında danışmaq üçün düzəldilən yığıncaq, toplaşmış adamlar heyəti; toplanış, iclas. *..Çünki bu bir məclisi-xasdır, ona binaən mənim tərəfimdən icazət olunur ki, oturasınız.* M.F.Axundzadə. *Hərzə nə şura və nə məclis bilir; Nə düşünür yaxşı, nə bir pis bilir.* M.Ə.Sabir. *Qüdrət danışdıqca məclisin sükutu daha da ağırlaşırdı..* M.Hüseyn. // Həmin toplanışın düzəldiyi yer.

2. Toy, şənlik, yas və s. bu kimi yerlərdə toplanan yığıncaq. *Toy məclisi. Şənlik məclisi. Təziyə məclisi.* – *Oxunur məclisdə xoş kəlimatı; Ox kimi bağrını dələr, ağlarsan.* M.V.Vidadi. *..Qızlar, gəlinlər də yığışıb gəlmiş, .. gözəl bir məclis düzəlmişdi.* M.Rzaquluzadə.

3. Türkiyədə və İranda qanunverici orqanın, parlamentin adı. *..Tehranda məclisi topa tutublar.* C.Məmmədquluzadə. ☐ **Məclisi-müəssisan,** yaxud **müəssislər məclisi** – burjua dövlətlərində: əsas qanun (konstitusiya) hazırlamaq üçün yaradılan müvəqqəti nümayəndəli orqan. *Məclisi-müəssisan seçkilərində xalq siyasi firqələr ətrafında toplaş*(*dı*)*..* S.Hüseyn. *..Milli konqres özünü məclisi-müəssisan elan etdi.* M.İbrahimov.

4. Teatr tamaşalarının ayrı-ayrı hissəsi; pərdə, şəkil. *Birinci məclis Rüstəm bəyin evində vaqe olur*. Ü.Hacıbəyov. *İkinci məclis vaqe olur bir balaca otaqda.* N.Vəzirov.

**MƏCMƏYİ** *is.* [*ər.*] Mis və ya başqa metaldan düzəldilmiş dairəvi yastı iri qab, iri sini. *Mis məcməyi. Naxışlı məcməyi. – O gənc kişi bir məcməyi və üzərində bir neçə stəkan çay daxil oldu.* T.Ş.Simurq. *Gözlərim ixtiyarsız olaraq məcməyidəki şeylərə tərəf çevrildi.* Qantəmir.

**MƏCMU** *is.* [*ər.*] 1. Bütün, tamam, hamı. *Seyyid dolanıb gün təki məcmui-cahanı; Dəryaları aşdım, dedim, Allah kərimdir.* S.Ə.Şirvani.

2. *riyaz.* Yekun, cəm. *Ədədlərin məcmusu.*

**MƏCMUƏ** *is.* [*ər.*] Məqalə, hekayə, şeir və s. toplusu; jurnal. "*Molla Nəsrəddin*" *məcmuəsi.* "*Qobustan*" *məcmuəsi. Məcmuənin yeni nömrəsi. – Bəlkə mən o sözləri götürüb məcmuəmə yazaydım, onda canını hara qoyardın?* C.Məmmədquluzadə. *Sonanın atası* .. "*Zənbur*", "*Tuti*" *kimi məcmuələrdən cürbəcür məlumatlar oxuyardı.* Ə.Əbülhəsən.

**MƏCNUN** *sif.* və *is.* [*ər.*] 1. Dəli, divanə. *Halı pəjmürdə, sanki bir məcnun; Anlaşılmaz nədir məramı onun*. H.Cavid. ☐ **Məcnun etmək** – dəli etmək, divanə etmək. **Məcnun olmaq** – dəli olmaq, divanə olmaq. *Məcnun olacaqsan bu təbiətlə nəhayət.* H.Cavid.

2. *məc.* Aşiq, vurğun, dəlicəsinə vurulmuş. *Hicrdə müttəsil ümmidi-visal ilə xoşam; Gəlməyib aləmə bir mən kimi məcnun aşiq.* Q.Zakir. *Niyə bu məcnunu etmiş fəramuş? Nədən ötrü olub biganə səndən?* Nəbati.

**MƏCNUNANƏ** *sif.* və *zərf* [*ər.* məcnun və *fars.* ...anə] Məcnun kimi, dəlicəsinə, ağlını itirmiş kimi. ..*Xavərin babası başıaçıq olaraq pərişanhal və məcnunanə bir qiyafətdə ağacların arasından çıxar.* H.Cavid.

**MƏCNUNLUQ** *is.* Dəlilik, divanəlik. *Məcnunluqdu mənə peşə; Düşmüşəm mahala, Maral!* Aşıq Ələsgər. *Eşqdən bu qədər söyləmək olmaz, Vahid! Mən bu məcnunluğa sevda deməyim, bəs nə deyim?* Ə.Vahid.

**MƏCRA** *is.* [*ər.*] 1. Suyun axdığı yataq, yol. *İnqilab daşqın bir çay kimi məcrasından çıxıb bütün Rusiyanı ağzına almışdı.* Çəmənzəminli. *Yalnız gur çayların məcrası deyil; Təbiət dəyişir, iqlim dəyişir.* O.Sarıvəlli.

2. *məc.* Bir şeyin, hadisənin və s.-nin inkişafının gedişi, istiqaməti, yolu. *Şairin həyat və fəaliyyəti də bu böyük hissin açdığı məcra ilə irəliyə doğru istiqamət almışdı..* Ə.Məmmədxanlı. [Əlikram] ..*söhbətin məcrasını özgə səmtə salmağa səy elədi..* B.Bayramov.

**MƏCRUH** *sif.* [*ər.*] *köhn.* 1. Yaralanmış, yaralı.

2. Biabır edilmiş, ləkələnmiş.

3. Etimada layiq olmayan, etibarsız sayılan.

**MƏCUN** *is.* [*ər.*] 1. Xalq təbabətində xəstə və zəif adamlara vermək üçün xüsusi hazırlanmış xəmirvari bir maddə, dərman.

2. *dan.* Çox dadlı, ləzzətli, canaxeyirli şey haqqında. *Xörək deyil, məcundur. – Bax, bu xurma Bağdad xurmasıdı, plovun qarasına qoydur, ye, elə bil ki, məcundur.* C.Məmmədquluzadə. ..[Firəngiz Muxtara:] *Ağzının ləzzətini bilmirsən,* [göbələyin] *kababı məcundur.* B.Bayramov.

**MƏCUS** *is.* [*ər.*] Qədim iranlıların atəşpərəstlik dini.

**MƏCUSİ** *sif.* [*ər.*] Məcus, atəşpərəst dinində olan; atəşpərəst.

**MƏDAXİL** *is.* [*ər.* "mədxəl" söz. cəmi] Bir idarə, ticarət-sənaye müəssisəsi və ya şəxsin bütün gəliri; gəlir (*məxaric* əksi). *Müəssisənin mədaxili ildən-ilə artır. – Xudayar bəy .. əkilmiş zəmiləri özü öz malı kimi biçirdi, döyürdü və mədaxili öz babasından qalan mal kimi gətirib tökürdü evinə*. C.Məmmədquluzadə.

**MƏDAXİLLİ** *sif.* Gəlirli, mənfəətli, qazanclı, çoxlu gəlir verən, mədaxil gətirən. *Mədaxilli iş. –* ..[Bir sıra müəllimlər] *mədaxilli sənətlərin və avam nəzərində hörmətli sayılan başqa qulluqların dalısınca gediblər.* F.Köçərli.

**MƏDAXİLSİZ** *sif.* Gəlirsiz, qazancsız, mənfəətsiz, mədaxili olmayan və ya az olan.

**MƏDAR** *is.* [*ər.*] *köhn.* bax **orbit**. ..*Yerin kürəsi öz mədarından çıxmayacaqdır*. M.İbrahimov.

**MƏDD** *is.* [*ər.*] 1. *coğr. köhn.* bax **qabarma**$^2$ (*cəzr* müqabili).

2. Ərəb əlifbasında əlifin ("ا") "a" kimi oxunması üçün üstünə qoyulan diakritik işarə (~).

**MƏDDAH** *sif.* və *is.* Mübaliğə ilə bir adamı və ya bir şeyi mədh və tərif edən; mədhnamə

yazan. *Vəsfin etmək üçün sənin tək şahın; Nizami, Xaqani gərək məddahın; Zakirin hədyanı sənə yetişməz.* Q.Zakir. [Canbalayev Rəşidə:] *Sən belə məddahlardan olma, bala!* İ.Hüseynov.

**MƏDDAHLIQ** *is.* Məddahın işi; həddindən artıq tərifləmə. *Məddahlıq etmək.*

**MƏDD-CƏZR** *is. coğr. köhn.* Dəniz suyunun vaxtaşırı qalxması və çəkilməsi, artması və azalması hadisəsi; qabarma-çəkilmə.

**MƏDƏ** *is.* [*ər.* midə] *anat.* İnsanda və heyvanlarda qarın boşluğunun yuxarı hissəsində yerləşən həzm orqanı. *Mədə ağrısı. Mədə yarası.*

**MƏDƏALTI** *sif. anat.* Mədənin altında olan, mədənin altında yerləşən. *Mədəaltı vəzi.*

**MƏDƏCİK** *is. anat.* Ürəyin, qan damarları ilə hərəkətini nizama salan hissəsi.

**MƏDƏD** [*ər.*] 1. *is.* Kömək, yardım, imdad, aman. *Müşküldür arizə divandan mədəd.* Q.Zakir. [Həcər] *əl atıb aynalını bərk-bərk sıxdı: – Səndən mədəd! – dedi.* S.Rəhimov. ☐ **Mədəd vermək (eyləmək, qılmaq)** *klas.* – kömək əli uzatmaq, yardım etmək, imdada çatmaq. *Saqi, mədəd et ki, dərdməndəm! Qəm silsiləsinə paybəndəm.* Füzuli. *Ol qaşı qibləyə üz sürtmək istər; Mədəd eylə iqbalına Vaqifin.* M.P.Vaqif.

2. *nida*. Aman! kömək edin! dada çatın! (çox vaxt “ay” nidası ilə işlədilir). [Koroğlu:] *Nə yorğan var, nə də cecim; Zülüm, ay mədəd, ay mədəd!* “Koroğlu”. *Dost yolunda cəfa çəkdim, can üzdüm; Yetişmədim bir məkana, ay mədəd!* Q.Zakir.

**MƏDƏDÇİ** *sif.* və *is. köhn.* 1. Əl tutan, kömək edən, mədəd olan.

2. Bir işdə başqasına muzdla kömək edən adam; köməkçi. *Hər dəfə çörək bişirən vaxt Həlimə xala .. övrət qonşularından özünə mədədçi çağırardı.* C.Məmmədquluzadə.

**MƏDƏDÇİLİK** *is.* 1. Kömək əli uzatma, köməkçi olma, yardım etmə.

2. Bir işi görmək üçün başqasına muzdla kömək etmə; köməkçilik, yardımçılıq. *Sevər .. məhəllələrində olan varlıların evində mədədçilik edər; çörək yapar, paltar yuyardı.* P.Makulu.

**MƏDƏDKAR** *is.* [*ər.* mədəd və *fars.* ...kar] *klas.* Əldən tutan, kömək edən, imdada çatan, yardım edən. *A çocuq, get, sənə haq yar olsun; Cümlə halında mədədkar olsun.* A.Səhhət.

**MƏDƏDKARLIQ** *is. köhn.* Kömək etmə, yardım göstərmə, imdada yetmə.

**MƏDƏN** *is.* [*ər.*] 1. Yer altından çıxarılan faydalı qazıntı (metal külçəsi, mineral və s.). *Mədən çıxarmaq. Yeraltı mədənlər. Mədən suları* (*tərkibində minerallar olan müalicə suları*).

2. Faydalı qazıntılar, neft və s. çıxarılan yer. *Qızıl mədəni. – Aynanın atası neft mühəndisi idi, günün çox hissəsini mədəndə keçirirdi.* İ.Əfəndiyev. *Babası vaxtilə neft mədənlərində fəhləlik etmişdi.* M.Rzaquluzadə.

3. *məc.* Bir şeyin bol olan yeri. *Qarabağ xanəndə mədənidir*. Ə.Haqverdiyev. // *məc.* Qoşulduğu sözün ifadə etdiyi şeyin bolluğunu, çoxluğunu bildirir. [Bəhram:] *Ey Fitnə, sən; Ağıl, kamal mədənisən!* A.Şaiq.

**MƏDƏNARASI** *sif.* Mədən ərazisi daxilində və ya mədənlər arasında olan. *Yağır mədənarası yollara bir narın qar; Bu yollarda hələ də onun ayaq izi var.* Ə.Cəmil.

**MƏDƏNÇİ** *is.* 1. *köhn.* Mədən sahibi, mədəni olan adam. *Neft mədənçiləri. – Araz gülərək istehza ilə: – O zaman biz də mədənçi olarıq! – dedi.* A.Şaiq. [Eyvaz:] *..Bizə o lazımdır ki, işçilərin əməyini udan mədənçilər və gönünü soyan monarxiya və burjuaziya hakimiyyəti alt-üst olsun.* C.Cabbarlı.

2. Mədəndə işləyən fəhlə. *Mədənçi ailəsi.*

**MƏDƏNİ**[1] *sif.* [*ər.*] 1. Mədəniyyətcə çox inkişaf etmiş, mədəniyyətin yüksək dərəcəsində olan. *Mədəni mühit. Varlı və mədəni həyat.* // Cəmiyyətdə özünü aparma üsullarına, ədəb qaydalarına yaxşı bələd olan; tərbiyəli. *Mədəni adam. – Qadının qarşısında 25 yaşlı, .. gözəl, yaraşıqlı, ədəbli, məlumatlı və mədəni bir gənc oturmuşdu.* M.S.Ordubadi.

2. Mədəniyyətlə bağlı olan, mədəniyyətə aid olan. *Əhalinin mədəni inkişafı. Xalqlar arasında mədəni əlaqə. Mədəni xidmət.*

3. Əkilən, becərilən (*yabanı, cır* ziddi). *Mədəni bitkilər. – Bəzi yerlərdə meşə öz şəklini dəyişib, insan tərəfindən salınmış mədəni bir parka bənzəyirdi.* H.Seyidbəyli.

**MƏDƏNİ**[2] *sif.* [*ər.*] Mədəndən çıxarılmış mineraldan ibarət olan, mineraldan düzəldilmiş. *Mədəni gübrə. – ..Bu boyaq* (*umbra*)

*müxtəlif mədəni hissələrin qarışığından ibarət olan gildir.* A.Quliyev.

**MƏDƏNİ-KÜTLƏVİ** *sif.* Kütlələrin mədəni tələbatına xidmət edən, xalqın mədəniyyətini artırmaq məqsədilə görülən. *Mədəni-kütləvi tədbirlər.*

**MƏDƏNİLƏŞDİRİLMƏ** "Mədəniləşdirilmək"dən *f.is.*

**MƏDƏNİLƏŞDİRİLMƏK** *məch.* Mədəni hala salınmaq, mədəni edilmək.

**MƏDƏNİLƏŞDİRMƏ** "Mədəniləşdirmək"dən *f.is.*

**MƏDƏNİLƏŞDİRMƏK** *f.* Mədəni hala salmaq, mədəni etmək.

**MƏDƏNİLƏŞMƏ** "Mədəniləşmək"dən *f.is.*

**MƏDƏNİLƏŞMƏK** *f.* Mədəni şəklə düşmək, mədəni olmaq.

**MƏDƏNİLİK** *is.* Mədəniyyətin səviyyəsi, dərəcəsi.

**MƏDƏNİYYƏT** *is.* [*ər.*] 1. İnsan cəmiyyətinin istehsal sahəsində, ictimai və mənəvi həyatda əldə etdiyi nailiyyətlərin məcmusu. *Maddi mədəniyyət nümunələri. Mədəniyyət sahəsində irəliləyiş. – Küp qəbirlər mədəniyyəti alban tayfalarının hakim mədəniyyətinə çevrildi.* ("Azərbaycan tarixi").

2. Hər hansı bir xalqın və ya sinfin müəyyən dövrdə əldə etdiyi belə nailiyyətlərin səviyyəsi. *Cəlil Məmmədquluzadə* (*Molla Nəsrəddin*) *Azərbaycan mədəniyyəti və maarifi tarixində tamamilə yeni və parlaq bir dövr açdı.* M.İbrahimov. // Təsərrüfat və ya zehni fəaliyyətin, hər hansı birisinin inkişaf səviyyəsi. *İstehsalat mədəniyyəti. Nitq mədəniyyəti.*

3. Savadlılıq, elmlilik, biliklilik. *Yazıçı mədəniyyəti.* // Cəmiyyətdə özünü apara bilmə; tərbiyəlilik. *Hamı bir nəfərtək sakit olmuşdur; Bu da timsalıdır mədəniyyətin.* S.Vurğun. // Mədəni adamın tələblərinə uyğun olan həyat şəraitinin məcmusu. *Yaşayış mədəniyyəti.*

**MƏDƏNİYYƏTLİ** b a x **mədəni** 1-ci mənada. *Onlar mədəniyyətli adamlardır.* C.Məmmədquluzadə.

**MƏDƏNİYYƏTSİZ** *sif.* 1. Mədəniyyətin aşağı səviyyəsində olan (duran), mədəniyyəti olmayan.

2. Mədəniyyətdən uzaq; qeyri-mədəni, kobud, qaba. *Mədəniyyətsiz adam.*

**MƏDƏNİYYƏTSİZLİK** *is.* Mədəniyyətin aşağı pilləsində olma; gerilik, qeyri-mədənilik, mədəniyyətdən uzaqlıq, kobudluq, qabalıq; qeyri-mədəni hərəkət.

**MƏDFƏN** *is.* [*ər.*] *klas.* Qəbir, məzar. [Rəmzi:] *Kefinə, bax, sanki bu dünya nədir? Məskəni olmuş ulu xaqanların; Mədfənidir qorxulu sultanların.* H.Cavid. *Hər pambıq tarlası düşmənə mədfən; Hər açılan qoza ona bir kəfən.* M.Müşfiq.

**MƏDH** *is.* [*ər.*] 1. Həddindən artıq şişirdilmiş tərif; tərifləmə, vəsf. *Nemət əl çəkmədi, ondan üz döndərən xanımı izləyə-izləyə .. mədhində davam etdi.* Çəmənzəminli. □ **Mədh etmək (eləmək, qılmaq)** – tərifləmək, vəsf etmək. *Mədh etdiyim çinar boyundur sənin.* M.Müşfiq. [Sona] *da Natiqi mədh eləyən cümlələr demək istəyirdi.* B.Bayramov.

2. B a x **mədhiyyə**.

**MƏDHİYYƏ** *is.* [*ər.*] *ədəb.* Birini mədh etmək, tərifləmək məqsədilə yazılmış şeir; mədhnamə, mədh.

**MƏDHİYYƏÇİ** b a x **məddah**.

**MƏDHİYYƏÇİLİK** *is.* b a x **məddahlıq**.

**MƏDHNAMƏ** *is.* [*ər.* mədh və *fars.* ...namə] Bir şəxsi və ya şeyi tərif etmək məqsədilə yazılmış şeir; mədhiyyə. *..Osmanlı ədiblərindən Xocazadə Məhəmməd Übeydulla bəy əfəndi öz barəsində ərəbcə yazdığı mədhnamələri oxuduq.* C.Məmmədquluzadə. *Şairlərdən ancaq Əbül-Üla Atabəyə təqdim edilərək yazdığı mədhnaməni oxudu.* M.S.Ordubadi. // Ümumiyyətlə, tərif (mənfi mənada işlənir). *Məqalə deyil, mədhnamədir.* – [Xanlar] *badələri qaldırıb, bir-birinə mədhnamələr deyib eyşi davam etdirdilər.* S.Rəhimov.

**MƏDXƏL** *is.* [*ər.*] *klas.* Müqəddimə, giriş.

**MƏDRƏSƏ** *is.* [*ər.*] Dini məktəb, ruhani məktəbi. *Təzəpirdə bir yaxşı məscidi-ali; Yanında mədrəsədən ötrü hücrələr varmış.* Ə.Nəzmi. // *köhn.* Ümumiyyətlə məktəb, tədris müəssisəsi. *Hər vilayətdə şəfaxanələr tikilsin və mədrəsələr açılsın.* M.F.Axundzadə. *Mədrəsələr dünyada ondan ötrü qoyulublar ki, orada təhsil tapanlar oxuyub-yazmaq öyrənsinlər.* C.Məmmədquluzadə. *Bir əlində kitabça, bir əlində yasəmən; Məhəmməd asta-asta qayıdır mədrəsədən.* B.Vahabzadə.

**MƏƏTTƏL** *is.* [*ər.* müəttəl] 1. Gözləmə, intizar. *Elə kəndlilər bu sözün məəttəli idi*(*lər*). Qantəmir. [Vahid:] *Elə bil anam bu suala məəttəl imiş*. B.Bayramov. // Yubanma, intizarda olma. [Xannazir öz dəstəsinə:] *Daha nəyin məəttəlisiniz, irəli!* P.Makulu. ◻ **Məəttəl etmək (eləmək)** – yubatmaq, intizarda qoymaq, gözlətmək. [Qızın atası:] *Gedin, tez başlayın, .. camaatı məəttəl eləməyin*. S.Rəhman. **Məəttəl olmaq** – yubanmaq, gözləmək. [Ağa Salman:] *Ümmidim budur ki, uzun iş olmasın. Yoxsa mənə çox məəttəl olmaq mümkün deyil!* M.F.Axundzadə. [Katib:] *Yox, bu saat gələr, məəttəl olmazsan.* Ə.Haqverdiyev.

2. Təəccüblü, heyran. *Mən onun işlərinə məəttələm.* ◻ **Məəttəl qalmaq** – təəccüb etmək, çaşıb qalmaq, nə edəcəyini bilməmək, baş çıxarmamaq. *..Məəttəl qalmışam, bilmirəm, yazım, ya yox.* C.Məmmədquluzadə. *Nərgiz lap məəttəl qaldı*. Ə.Məmmədxanlı. [Qarı nənə:] *Gərək ona elə bir şey öyrədim ki, hamı məəttəl qalsın*. M.Dilbazi.

3. İşsiz, boş, bikar. ◻ **Məəttəl qalmaq** – çatışmayan bir şeyə görə bikar qalmaq, iş görə bilməmək, dayanıb durmaq. [Bəlli Əhməd:] *Qırılıbdı sazım, məəttəl qalmışam; Usta qulun ollam, al, düzəlt sazı.* "Koroğlu". [Anam:] *Sən bilmirsən ki, adam bəzən bir mismar üçün .. məəttəl qalır?* Mir Cəlal.

**MƏƏTTƏLÇİLİK** *is. dan.* Çatışmayan bir şeyə görə yubanma, məəttəl olma, iş görə bilməmə; məəttəllik. *Nə cavab verim? Məəttəlçilikdir*. H.Nəzərli. ◻ **Məəttəlçilik çəkmək** – çətinlik çəkmək. *O indi qızın üzünə baxa bilmirdi, çünki cavabda məəttəlçilik çəkirdi.* Ə.Əbülhəsən.

**MƏƏTTƏLLİK** b a x **məəttəlçilik**. *Şəhərimizin bu çağacan notariusu yoxdur, ona binaən çox məəttəllik çəkirdik.* "Əkinçi".

**MƏFHUM** *is.* [*ər.*] Bir şey haqqında məntiqi cəhətdən formalaşmış ümumi fikir; anlayış. *Dəyər məfhumu. Sinif məfhumu. – Yaxşı, yamanlıq, toxluq və aclıq məfhumlarına qarşı yenə yad və laqeyd idim.* Çəmənzəminli. *Qəhrəmanlıq məfhumunun geniş çərçivəsi, şeirdən olduqca yeni və yüksək təsvir vasitələri tələb edəcəkdir.* M.Hüseyn.

**MƏFKURƏ** [*ər.*] b a x **ideologiya**. *Burjua məfkurəsi. – Dünya məfkurə mübarizəsində çalxanır.* S.Vurğun.

**MƏFKURƏLİ** b a x **ideyalı**. [Qadın ovçuya:] *Nə yaman məfkurəli adamsan.* H.Seyidbəyli.

**MƏFKURƏLİLİK** b a x **ideyalılıq**.

**MƏFKURƏSİZ** b a x **ideyasız**.

**MƏFKURƏSİZLİK** b a x **ideyasızlıq**.

**MƏFKURƏVİ** [*ər.*] b a x **ideoloji**. *Məfkurəvi mübarizə.*

**MƏFRƏŞ** *is.* [*ər.*] Yorğan-döşək, xalça-palaz və s. şeyləri qablamaq üçün palaz kimi toxunmuş dördkünc çuval, kisə. *Məfrəşi çırpmaq. – Rəşid isə özü ilə aparacaq şeyləri qutulara və məfrəşlərə yığıb bağçalarında gəzir idi*. İ.Musabəyov. *Şeyləri .. məfrəşlərə qablayırdılar..* İ.Əfəndiyev. // İçində yorğan-döşək, xalça-palaz, yun və s. yığılmış həmin çuval, kisə. *Bir tərəfdə un çuvalları düzülüb, bir tərəfdə yağ dəriləri, yun məfrəşləri qoyulubdur.* M.F.Axundzadə. *Maşının üstünə böyük bir məfrəş sərilmiş, yük yerinə çamadan qoyulmuşdu..* M.İbrahimov.

**MƏFSƏL** *is.* [*ər.*] Oynaq, bənd, buğum.

**MƏFTİL** *is.* [*ər.*] Nazik və ya qalın ip şəklində olan metal məmulat. *Mis məftil. Polad məftil. Tikanlı məftil* (*üzərində tikanlar olan məftil*). // Məftildən olan, məftildən düzəldilmiş. *Düşmənin məftil hasarını dağıtmaq, puça çıxarmaq vəzifəsi Fərhadın vzvoduna tapşırılmışdı.* Ə.Vəliyev.

**MƏFTUN** *sif.* [*ər.*] Vurğun, özünü unudacaq dərəcədə vurulmuş, eşqə giriftar. *Kamran gözlərini Səidə xanıma zillədi, nə isə çox məftun baxışlarla onu süzməyə başladı.* M.Hüseyn. ◻ **Məftun etmək** – özünü sevdirmək, özünə bənd etmək, aşiq etmək. **Məftun olmaq** – özünü unudacaq dərəcədə vurulmaq, sevmək. *Sən gərçi olubsan ona məftun; Oldur tələbində səndən əfzun.* Füzuli. // Son dərəcədə valeh, heyran. *Xanım görmədiyi ölkənin xəyali gözəlliyinə məftun bir halda sözünə davam edirdi.* Çəmənzəminli. *Sizi bir elçimi göndərmiş bahar? Yoxsa məftunsunuz ətirli gülə?* N.Rəfibəyli. ◻ **Məftun etmək** – valeh etmək, heyran etmək. *Haman qız bütün səyahətçilərin qəlbini .. məftun etmişdi.* M.S.Ordubadi. *Yaman məftun etmiş onu bu əsər; Cəmilə oxuyur axşamdan bəri*. B.Vahabzadə. **Məftun olmaq** – heyran qalmaq, valeh olmaq. *Məftun olaraq sevdim onu,*

*heyrətə daldım.* A.Şaiq. *Bunları duyduqca, düşündükcə mən; Həyata, varlığa məftun oluram.* S.Vurğun.

**MƏFTUNCASINA** *zərf* Məftun olmuş kimi; vurğuncasına, heyrancasına, sehrlənmiş kimi. *Məftuncasına baxmaq.*

**MƏFTUNEDİCİ** *sif.* Öz gözəlliyi ilə məftun edən; valehedici, heyranedici. *Məftunedici gözəllik. Məftunedici mənzərə. – Dəli dağ nə qədər haylı-küylü, nə qədər vahiməli-qorxulu olsa da .. hər bir dağdan məftunedici* (z.) *gəlirdi.* S.Rəhimov.

**MƏFTUNİYYƏT** *is. klas.* Məftunluq. *..Bir qismi də qara gözlərə, qara qıvırcıq saçlara, açıq-buğdayı rəngə daha ziyada məftuniyyət göstərir.* A.Şaiq.

**MƏFTUNLAŞMAQ** *f.* Məftun olmaq, heyran qalmaq, valeh olmaq. *Yürüyür dağ aşağı orda çoban da dərəyə; İştə məftunlaşır insan bu gözəl mənzərəyə.* A.Səhhət.

**MƏFTUNLUQ** *is.* Məftun olmuş adamın halı; vurğunluq, valehlik, heyranlıq. *Dilara məftunluq içərisində məktəbdən gələn səsləri dinləməyə başladı.* Ə.Məmmədxanlı.

**MƏGƏR** [*fars.*] 1. *əd.* Sual məqamında işlənib, şübhə, inamsızlıq və ya təəccüb bildirir: olmaya, bəs, yoxsa (bəzən "ki" bağlayıcısı ilə işlədilir). *Məgər sənin xəbərin yoxdur? Məgər o gəlməyəcək? – Məgər ki, aşiqin qəmin yeməzsən; Bu cövrü cəfadan sən inciməzsən.* M.P.Vaqif. [Şərəfnisə xanım:] *Uşağı yerə girsin. Dinc oturur məgər.* M.F.Axundzadə. *Ədalətlə deyin, mən; Yalan danışdım məgər?* B.Vahabzadə.

2. *bağl.* Ancaq, fəqət. [Səfərəli:] *..Bu iş heç kimin işi deyil, məgər ki, Rəhimin.* N.Vəzirov. [Hacı Rüstəmin] *həmişə şüarı bu idi: fürsəti fövr eyləməz aqil, məgər nadan ola.* Ə.Haqverdiyev.

**MƏĞBUN** [*ər.*] b a x **məğmun**. *Canım aldın mey üçün, saqi, içirdin mənə qan; Dad əlindən ki, məni al ilə məğbun eylədin.* Füzuli. *Ol ki, bir şişə şərabi-ala dünyanı verib; Etiqadım budur, ol kəs genə məğbun eylər.* S.Ə.Şirvani.

**MƏĞLƏTƏ** *is.* [*ər.*] Qarışıqlıq, araqarışma, dava-dalaş, hay-küy. ☐ **Məğlətə salmaq** – ara qarışdırmaq, qarışıqlıq salmaq, hay-küy qoparmaq, dava-dalaş salmaq. [Hacı Əhməd:] *O bizim kəndimizə məğlətə salır.* C.Cabbarlı.

**MƏĞLUB** *sif.* [*ər.*] Müharibədə, yarışda, müsabiqədə, mübahisədə və s.-də məğlub olmuş, basılmış (*qalib* əksi). ☐ **Məğlub etmək** – müharibədə, yarışda, mübahisədə və s.-də basmaq, qalib gəlmək, üstün gəlmək, udmaq. *Nəbi düşməni məğlub edir və haman günü Şuşa qalasına gəlir.* "Qaçaq Nəbi". [Bəkir] *Harun .. düşməni məğlub etdi!* Ü.Hacıbəyov. **Məğlub olmaq** – müharibədə, yarışda, müsabiqədə, mübahisə və s.-də basılmaq. *Tahirə də elə bil Baharın qarşısında məğlub oldu.* B.Bayramov.

**MƏĞLUBEDİLMƏZ** *sif.* Məğlubiyyət bilməyən, məğlub olunmaz; basılmaz, yenilməz, çox güclü, həmişə qalib gələn. *Məğlubedilməz ordu.* – [Qızıl Arslan:] *İdarə etdiyimiz məmləkətin xalqı yenilməz və məğlubedilməz bir xalqdır.* M.S.Ordubadi.

**MƏĞLUBEDİLMƏZLİK** *is.* Məğlubiyyət bilməmə, məğlub edilə bilməmə, həmişə qalib gəlmə, basılmazlıq, yenilməzlik.

**MƏĞLUBİYYƏT** *is.* [*ər.*] Məğlub olma, basılma (*qalibiyyət* əksi). *Çarizm və qara irtica meydan sulasa da, müvəqqəti məğlubiyyət inqilabçıları ruhdan salmadı.* M.İbrahimov. ☐ **Məğlubiyyətə uğramaq** – məğlub olmaq, basılmaq.

**MƏĞLUBLUQ** b a x **məğlubiyyət**.

**MƏĞMUN** *sif.* [*ər.*] 1. Aldanmış, zərər çəkmiş, uduzmuş, gözlədiyi şeydən əli çıxmış, məhrum olmuş. *Böyük özünü aldanmış saydığı kimi, Məhərrəm də özünü məğmun hesab edirdi.* Mir Cəlal. ☐ **Məğmun etmək (eləmək)** – zərərə salmaq, aldatmaq, gözlədiyi şeydən məhrum etmək. [Kərbəlayı Tapdıq] *mənə kəbin kəsdi, hamısını içəri ötürdü, məni məğmun elədi.* Mir Cəlal. **Məğmun olmaq** – aldanmaq, zərərə düşmək, uduzmaq, əli çıxmaq, gözlədiyi şeydən məhrum olmaq.

2. Aciz, bacarıqsız, əfəl, əlindən iş gəlməyən. *Bəhlul da kənd uşağı deyilmi? O da sənin kimi utancaq, məğmunun biri idi.* Mir Cəlal. ☐ **Məğmun etmək (eləmək)** – aciz etmək; məhrum etmək, əlindən almaq. *Məni məğmun edib dövrü zamanım, nə edim? Hələ bir çet qəpiyə yoxdu gümanım, nə edim?* C.Cabbarlı. *Amma bağçılıq məsələsi bu il*

*bizi bir balaca məğmun elədi.* "Kirpi". // Heç bir şeyi olmayan, hər şeydən məhrum. [Kəlbalı Mirzəyə:] *Sənin arvadın vardır, bizim kimi məğmun deyilsən ki?* S.Rəhimov.

**MƏĞMUNLUQ** *is.* 1. Zərər çəkmiş, uduzmuş, aldanmış, bir şeydən məhrum olmuş adamın halı.

2. Acizlik, bacarıqsızlıq.

**MƏĞRİB** *is.* [*ər.*] Günbatan, qərb (*məşriq* əksi). // Şərqə müqabil cəhət. *Sübhə az qalıb və ay da məğrib tərəfə yaxınlaşıb batmağa hazırlaşır.* Ə.Haqverdiyev. *Məğribdən məşriqə kimi; Uzanıbdı qolun, dağlar!* Aşıq Şəmşir.

**MƏĞRUR** *sif.* [*ər.*] 1. Öz ləyaqətini, üstünlüyünü hiss edən, mənlik hissi olan; qürurlu, vüqarlı. [Rəmzi:] *Alp Arslan, o məğrur insan; Geri dönmüş, sanırım, Ceyhundan.* H.Cavid. // İs. mənasında. [Salman] *məğrurlara .. xəlvətcə güzəştə gedir, üzlərinə gülümsəyirdi.* M.İbrahimov. // *məc.* Əzəmətli, möhtəşəm, qürurlu. [Attal:] *Hər yerə at sürdük, bu məğrur dünya; Duz ilə, çörəklə çıxdı qarşıya.* A.Şaiq. *İstəməm, axmasın gözlərin yaşı! Çatılmasın məğrur ölkəmin qaşı!* M.Müşfiq. // *Zərf mənasında*. Əzəmətlə, həşəmətlə, qürurla. *Budur Qız qalası, gözəl abidə; Onun məğrur duran qədim tağları.* M.Rahim. *Üstünə alovdan yağır bir yağmur; Sənsə qala kimi durmusan məğrur.* N.Rəfibəyli.

2. Başqalarına xor baxan, lovğa, təkəbbürlü, təşəxxüslü, iddialı. *Məğrursan, ey gül, xəbərin yoxdur özündən; Əyyami-xəzan gəlsə, xəbərdar olacaqsan.* S.Ə.Şirvani.

**məğrur-məğrur** *zərf* 1. B a x **məğrurcasına**. *Başımızın üzərində üçrəngli bayrağımız məğrur-məğrur dalğalanır.*

2. Təşəxxüslə, təkəbbürlə, lovğa-lovğa. *Məğrur-məğrur baxmaq*.

**MƏĞRURANƏ** *sif.* [*ər.* məğrur və *fars.* ...anə] 1. Məğrur, məğrur bir tərzdə, vüqarla. *Məğrurancə hərəkət.* – [Şah:] *Xurşid, .. xoşbəxtəm ki, sənin məğruranə sözlərini qəbul edib sənət öyrəndim.* Ü.Hacıbəyov.

2. Təkəbbürlü, təşəxxüslü, məğrur. *Məğruranə baxış.*

**MƏĞRURCASINA** *zərf* Qürurla, vüqarla, məğrur bir tərzdə; məğrur-məğrur. *Məğrurcasına dayanmaq* (*baxmaq*).

**MƏĞRURLANMA** "Məğrurlanmaq"dan *f.is.*

**MƏĞRURLANMAQ** *f.* Boş-boşuna qürrələnmək, bir şeyə güvənmək, iddialanmaq.

**MƏĞRURLUQ** *is.* 1. Öz ləyaqət və yüksəkliyini hiss etmə, mənlik hissi; vüqar. [Vahid:] *Mənə hər şeydən artıq xoş gələn* [anamın] *məğrurluğu idi.* B.Bayramov.

2. Lovğalıq, təkəbbür, təşəxxüs, iddialılıq. *Məğrurluq eyləyib ustadam demə; Olar ki, bir yerdə dara düşərsən.* Aşıq Ələsgər. *Puan Qay* [avropalıların] .. *məğrurluqlarını, çinlilərə edilən zülmü pantomim tərzilə gözəlcəsinə göstərib xalqı güldürürdü.* S.S.Axundov.

**MƏĞŞUŞ** *sif. klas.* Qarma-qarışıq, hərcmərc, iğtişaşlı. *Belə vilayəti dağıtsın Tarı; Ziyadə məğşuşdur Ərəs kənarı.* Q.Zakir.

2. Halı özündə olmayan, əhvalı pozğun; bikef, kefsiz, halsız. *Yağır yağış, məğşuşdur əhvalım; Komamız sübhədək giryan olubdur.* Aşıq Mehdi. [Gülnisə:] *Bəhram! Halın məğşuşdur, nə olub məyər, oğlum!* C.Cabbarlı.

**MƏĞŞUŞLUQ** *is.* Qarma-qarışıqlıq, şuluqluq, hərc-mərclik, iğtişaş. [Allahverdi:] *Aram, deyirlər, Bakıda məğşuşluq var?* C.Cabbarlı. [Musa:] [Şeyx Feyzullah] *.. gedib, Şah Əbdüləzimdə oturub məğşuşluq salmaqla məşğuldur.* P.Makulu.

**MƏĞZ** *is.* [*fars.*] 1. *dan.* b a x **ləpə**[2]. *Badamın məğzi. Qoz məğzi.*

2. *məc.* Mahiyyət, əsas, əsil. *Vaqif gördü ki, İbrahim xan onun sözlərinin məğzini dərk etmir*. Çəmənzəminli. *Yenə də əsil mətləb, məsələnin məğzi Nadirin ruhuna əzab verən cəhəti aydınlaşdırmayıb məchul qaldı*. B.Talıblı.

**MƏĞZİBADAM** *is.* [*fars.*] Badam içi, badam ləpəsi. // Təmizlənmiş badam.

**MƏH** [*fars.*] *klas.* b a x **mah**. *Ey dil, ki hicrə doymayıb, istərsən ol məhi; Şükr et bu halə, yoxsa gələr bir bəla sana.* Füzuli. *Səndə nə gündür, ey məh, mehrin çırağı yanmaz*. Qövsi.

**MƏHABƏT** *sif.* [*ər.*] Görünüşcə əzəmətli, vüqarlı.

2. Dəhşətli.

3. *is.* Qorxu, çəkinmə hissi.

**MƏHAL** [*ər.*] *klas.* b a x **mahal**[2]. *Qərəz Füzuliyə ancaq əlində ölməkdir; Bəli, məhaldır ol həm, sən olacaq qatil.* Füzuli.

**MƏHARƏT** [*ər.*] *is.* Bir iş görməkdə ustalıq, bacarıq, qabiliyyət, hünər. *..Yandüdüyü çalmaqda əmioğlum kimi məharət göstərmək və qulaq asanları valeh etmək mənə xudayitaaladan qismət deyilmiş.* C.Məmmədquluzadə. *Hanı, göstər də bir cəsarətini; Görəlim barı son məharətini.* H.Cavid. ☐ **Məharət(ini) göstərmək** – qabiliyyətini, bacarığını, hünərini göstərmək. *Az bir zamanda Vaqif dövlət işlərində böyük məharət göstərib, bütün sarayda hörmət qazandı..* Çəmənzəminli. *Yaz gəlib səpin başlananda Əli əsil ustalığını, məharətini göstərdi.* B.Bayramov.

**MƏHARƏTLİ** *sif.* Məharəti olan; bacarıqlı, qabiliyyətli, mahir. *Məharətli usta. – ..Onun qonşuluğunda usta Cəfər adlı məharətli bənna və səliqəli gəc çəkən var.* C.Məmmədquluzadə. [Qəhrəman] *məharətli və peşəkar bir natiq kimi sözə başlayaraq dedi..* Ə.Vəliyev.

**MƏHARƏTLİLİK** *is.* Bacarıqlılıq, qabillik, qabiliyyətlilik, mahirlik.

**MƏHARƏTSİZ** *sif.* Məharəti olmayan, bacarıqsız, qabiliyyətsiz.

**MƏHARƏTSİZLİK** *is.* Məharətsiz olma; qabiliyyətsizlik, bacarıqsızlıq.

**MƏHBƏS** *is.* [*ər.*] Həbsxana. *Məhbəsə salmaq.* – [Aydəmir:] *..Mənim üçün ən qaranlıq bir məhbəsin yaşıl, azad bir çəməndən fərqi yoxdur..* C.Cabbarlı. *Diqqətlə saxlanılır Əjdər məhbəsdə; Sağalmış yarası, deyildir xəstə.* H.K.Sanılı. // Məc. mənada. [Cariyə:] *Sənsiz bütün cahan məhbəsdir ona.* H.Cavid. *Get-gedə ev Şahmar üçün bir məhbəsə dönür, min bir rəngli gül-çiçək onun üçün bir heçə çevrilirdi.* B.Bayramov.

**MƏHBƏSXANA** [*ər.* məhbəs və *fars.* ...xanə] b a x **məhbəs**.

**MƏHBUB** *is.* [*ər.*] *klas.* Sevgili, məşuq, istəkli (kişi). *Zatında çü var idi məhəbbət; Məhbubu görüncə tutdu ülfət.* Füzuli. *Könlümün sevgili məhbubu mənim; Vətənimdir, vətənimdir, vətənim.* A.Səhhət.

**MƏHBUBƏ** *is.* [*ər.*] Sevgili, məşuqə, istəkli (qadın – qız). *Şah Abbas günortadan üç saat keçmiş qəsrdə öz məhbubəsi Səlmi xatunla oturub söhbətə məşğul idi.* M.F.Axundzadə. *İşi bəhanə edib, həyətdə o yan-bu yana getdi, məhbubəsini gözaltı axtarmağa başladı.* Mir Cəlal.

**MƏHBUS** *is.* [*ər.*] Həbs olunmuş; dustaq. *Bu halda məhbuslar yerə yıxılıb şahın ayağına sürünürlər.* Ü.Hacıbəyov. *Sanki küçədən böyük bir məhbus dəstəsini Sibirə aparırlar.* S.Rəhman.

**MƏHBUSLUQ** *is.* Həbsdə olma, dustaqda olma; dustaqlıq.

**MƏHCUB** *sif.* [*ər.*] *klas.* Utanmış, utanan, utancaq. [Günəş] *məhcub və tutqun bir halda yatağına çəkildi.* A.Şaiq. *Səhərlər üfüqlər məhcub qız yanaqları kimi qızarırdı.* Ə.Məmmədxanlı. ☐ **Məhcub etmək** – utandırmaq. [Qızın] *yanaqları qüruba süslər verər, dodaqları gülləri məhcub edər qədər gözəl idi.* Çəmənzəminli. **Məhcub olmaq** – utanmaq, sıxılmaq, xəcalət çəkmək. *Şeytan kimi həqdən bu gün məhcub olan biganədir.* Nəsimi. *O gülgün çöhrə guya sarsılır, məhcub olur hər an.* H.Cavid.

**MƏHCUBLUQ** *is. klas.* Utanma, utancaqlıq, həya. *Ən gözəl və sevimli xüsusiyyətlərindən birisi, zahiri görünüşündə olan məhcubluğu, həyalılığı və utancaqlığı idi.* M.S.Ordubadi.

**MƏHDUD** *sif.* [*ər.*] 1. Əhatə olunmuş, dövrələnmiş, hüdudlanmış. *Hasarla məhdud bir ev.* ☐ **Məhdud etmək** – hədd qoymaq, hüdud qoymaq, məhdudlaşdırmaq.

2. Kiçik, əhəmiyyətsiz, az, cüzi. *İmkanlarımız məhduddur. Məhdud miqdarda. Vəsait məhduddur.*

3. *məc.* Məlumatı, biliyi az, dünyagörüşü dar. *Məhdud adam. Dünyagörüşü məhduddur. – Anamın övlad haqqında təsəvvürü də tamam məhdud və köhnə idi.* B.Bayramov.

**MƏHDUDİYYƏT** [*ər.*] b a x **məhdudluq**.

**MƏHDUDLANDIRILMA** "Məhdudlandırılmaq"dan *f.is.*

**MƏHDUDLANDIRILMAQ** b a x **məhdudlaşdırılmaq**.

**MƏHDUDLANDIRMA** "Məhdudlandırmaq"dan *f.is.*

**MƏHDUDLANDIRMAQ** b a x **məhdudlaşdırmaq**. *İmkanı məhdudlandırmaq.*

**MƏHDUDLANMA** "Məhdudlanmaq"dan *f.is.*

**MƏHDUDLANMAQ** *f.* Öz işi və hərəkətində müəyyən bir hədlə kifayətlənmək, ondan kənara çıxmamaq.

**MƏHDUDLAŞDIRILMA** "Məhdudlaşdırılmaq"dan *f.is.*

**MƏHDUDLAŞDIRILMAQ** *məch.* Müəyyən bir hüdud, çərçivə içinə alınmaq, müəyyən bir dairədə saxlanılmaq.

**MƏHDUDLAŞDIRICI** b a x **məhdudlayıcı**.

**MƏHDUDLAŞDIRMA** "Məhdudlaşdırmaq"dan *f.is.*

**MƏHDUDLAŞDIRMAQ** *f.* Müəyyən bir hüdud içinə almaq, məhdud etmək, hədd qoymaq, müəyyən həddə, çərçivədə saxlamaq. *İmkanı məhdudlaşdırmaq. – Bizim dövrümüz sənətkarı heç bir cəhətdən məhdudlaşdırmır*. M.Hüseyn.

**MƏHDUDLAŞMA** "Məhdudlaşmaq"dan *f.is.*

**MƏHDUDLAŞMAQ** *f.* Məhdud olmaq, müəyyən hədd-hüdud içərisində olmaq, kifayətlənmək. [Müəllimlərin] *ikiilliklə əlaqədar olaraq gördükləri işlər yalnız bununla məhdudlaşmır.* (Qəzetlərdən).

**MƏHDUDLAYICI** *sif.* Məhdud edən, məhdudlaşdıran, müəyyən ölçüdən, hüduddan kənara çıxmağa qoymayan; məhdudedici.

**MƏHDUDLUQ** *is.* Məhdud olma, müəyyən hədd-hüdud içərisində olma; məhdudiyyət. // Azlıq, kifayətsizlik, darlıq. *İmkanların məhdudluğu. Dünyagörüşünün məhdudluğu.*

**MƏHƏBBƏT** *is.* [*ər.*] 1. Eşq, sevgi, sevmə, sevişmə. *Aralarında məhəbbət var.* ☐ **Məhəbbət bağlamaq (salmaq)** – sevmək, vurulmaq, eşq yetirmək. *İlk zamanlar körpə ilə o qədər də maraqlanmayan ata yavaş-yavaş balasına məhəbbət saldı.* Ə.Vəliyev.

2. Ürəkdən, fədakarcasına bağlılıq; sevgi, dostluq, sədaqət; mehribanlıq. *Vətənə məhəbbət. Ana məhəbbəti*. – [Mehribanın] *çocuqlarına qarşı bəslədiyi məhəbbət onu məcbur edirdi ki, Zeynalın* "*işlərinə*" *qatlaşıb bir növ ilə keçinsin.* S.Hüseyn. *Ana! Sənin tükənməz əməyin, oxşayıcı şəfqətin, bəsləyici məhəbbətin, qəlb ülviyyətin kimə məlum deyil!* Mir Cəlal. ☐ **Məhəbbət bağlamaq** – ürəkdən bağlanmaq, sevmək, istəmək. [Piri baba:] *..Amma atanın qıza elə məhəbbət bağladığını görməmişəm.* S.S.Axundov. **Məhəbbət(ini) qazanmaq** – yaxşı işi, rəftarı ilə özünə məhəbbət doğurmaq, özünü istətmək, özünü sevdirmək. *Yoldaşların məhəbbətini qazanmaq. – ..Xalqın məhəbbətini qazandığımız bizim üçün böyük bir qələbədir.* M.S.Ordubadi.

3. Bir şeyə sonsuz maraq; meyil, həvəs, istək. *Musiqiyə məhəbbət. – Bəziləri belə güman eləyirlər ki, müsəlmanların yekə papaqlara məhəbbəti o vədədən başlayıb ki, uşaqlar başlayıblar Quran oxumağa.* C.Məmmədquluzadə.

**MƏHƏBBƏTANƏ** *zərf* [*ər.* məhəbbət və *fars.* ...anə] Dərin məhəbbətlə, sevgi hissi ilə. *Məhəbbətanə süzmək.* – [Molla Fərəc:] *Məhəbbətanə qızlara baxır.* M.Əliyev.

**MƏHƏBBƏTLİ** *sif.* Məhəbbət bəsləyən, məhəbbəti olan, məhəbbət ifadə edən. *Bu qədər adamın içində Məryəm Nadirin gözünə görünər-görünməz yenə də Zeynəbin məhəbbətli çöhrəsini yaradırdı*. B.Talıblı. // İs. mənasında. *Bir çox ülfətlinin, məhəbbətlinin; Bir mahcamallının qurbanıyam mən.* M.P.Vaqif.

**MƏHƏBBƏTNAMƏ** *is.* [*ər.* məhəbbət və *fars.* ...namə] 1. Dostyana məktub. [Vaqif:] *Mirzə Camal, Rum soltanına yazılmış məhəbbətnaməni ver görüm.* Çəmənzəminli.

2. Məhəbbət ifadə edən məktub, sevgi məktubu, eşqnamə. *Ümidim var məhəbbətnamədən məhv olmasın namım.* Qövsi.

**MƏHƏBBƏTSİZ** *sif.* Məhəbbəti, sevgisi olmayan. // *zərf* Məhəbbət olmadan; sevgisiz, istəksiz. *Məhəbbətsiz evlənmək.*

**MƏHƏCCƏR** *is.* [*ər.*] Balkonun, eyvanın, pilləkənin, körpünün kənarına çəkilən şəbəkə; barmaqlıq, sürahi. *Dəmir məhəccər. Taxta məhəccər. – Məşədibəy göyərtədə dəmir məhəccərə söykənib nəhayətsiz boşluqlara baxırdı.* M.Hüseyn. *Hətəm .. balkonun məhəccərinə söykəndi.* Mir Cəlal.

**MƏHƏCCƏRLİ** *sif.* Məhəccəri olan; sürahili, barmaqlıqlı. *Məhəccərli balkon. – Yaşıl məhəccərli dördkünc bağçada .. Nizaminin tuncdan tökülmüş miniatür heykəli qoyulmuşdu.* M.Hüseyn. *Səkilərin birində, bir tərəfdə taxtadan hamamçı üçün qabağı məhəccərli yer ayrılardı.* H.Sarabski.

**MƏHƏK** *is.* [*ər.*] Qızıl və gümüşün əyarını təyin edən bir cins daş. ☐ **Məhək daşı** – 1) məhək; 2) *məc.* bir şeyin keyfiyyəti, dəyərini göstərən şey. *Dil eyni zamanda şəxsiyyətin qabiliyyət və qanacaq dərəcəsini*

*bildirən bir məhək daşıdır.* M.İbrahimov. [Nəcəfalı:] *Bəli, sözümün canı budur ki, məni qınasanız da, adamın məhək daşı işdir, vəzifədir.* B.Bayramov. **Məhəkdən çıxmaq** – 1) məhək daşı ilə yoxlanmaq, saflığı təyin edilmək. [Molla Həmid:] *Otuz iki put iksiri .. otuz iki put misə vurub xalis məhəkdən çıxmış gümüş edəcəkdir.* M.F.Axundzadə; 2) *məc.* sınaqdan çıxmaq. **Məhəkə vurmaq (çəkmək)** – yoxlamaq, sınamaq, sınaqdan keçirmək. [Bəhram:] *Hər bir işdə gənəşərkən; Qızıl kimi hər sözü mən; Tərəzidə çəkə-çəkə; Tez vururam bu məhəkə.* A.Şaiq.

**MƏHƏL**[1] [*ər.*]: **məhəl qoymamaq** – etina etməmək, maraqlanmamaq; saymamaq. *Mən xotkar qızıyam, Nigardır adım; Şahlara, xanlara məhəl qoymadım.* "Koroğlu". [Birisi:] *Bəy, qonşunun qızına gözüm düşüb, hərçi çalışıram, zalım qızı məhəl qoymur.* Ə.Haqverdiyev.

**MƏHƏL**[2] *is.* [*ər.*] Yer. *Necə surət bağlasın könlüm xilasi-eşqdən; Eşqdir bir hal kim, ol halə könlümdür məhəl.* Füzuli.

**MƏHƏLÇİLİK** *is.* 1. Bax **yerliçilik**.

2. Öz yazılarında, əsərlərində yerli sözlər işlətmə meyli. *Bədii əsərlərdə məhəlçiliyə yol verməməli.*

**MƏHƏLLƏ** *is.* [*ər.*] 1. Bir şəhər və ya qəsəbənin bölündüyü hissələrdən hər biri. *Hər məhəllədən iki-üç nəfər adam uşaqları ilə bir yerdə arabaya, faytona, ata, eşşəyə minib,* [pirə] *gedəcək idilər.* N.Nərimanov. *Şeyx Şəbanın arvadı Gülsüm xala da məhəllədə məşhur idi.* Ə.Haqverdiyev. *Nəcibə bizim məhəllədə gözədəyən qızlardan biridir.* Mir Cəlal.

2. Şəhərin, iri binalar olan, kəsişən yollar və ya meydanlar arasında yerləşən hissəsi; kvartal. *Nərimanov prospektinin 513-cü məhəlləsi.* ◻ **Məhəllə komitəsi** – bir məhəllədə yaşayan əhali tərəfindən seçilən, təmizlik, mənzil, nizam-intizam, qayda və b. işlərə baxan ictimai təşkilat. *Məhəllə komitəsinin qərarı. Məhəllə komitəsinin üzvü.*

**MƏHƏLLİ** *sif.* Yalnız bir məhəllə, bir yerə məxsus və aid olan, ümumxalq mahiyyəti daşımayan; yerli. *Məhəlli sözlər. Məhəlli idarələr. – Belə zamanda məhəlli əsərlər yazmaqla kifayətlənmək olmaz.* M.İbrahimov. ◻ **Məhəlli komitə** *köhn.* – yerli komitə (həmkarlar ittifaqının yerli komitəsi). *Məhəlli komitə onun vəzifəsini .. başqa birisinə vermək barəsində olan müraciətini bir həftə təxirə uğratmışdısa da, yenə Zeynaldan bir xəbər çıxmamışdı.* S.Hüseyn.

**MƏHƏRRƏM** *is.* [*ər.* mühərrəm] 1. Ərəb qəməri təqviminin birinci ayı (şiələrin imamları bu ayda qətl edildiyi üçün yas ayı hesab olunur). [Məşədi Səttar] *hər il məhərrəm ayında yeddi gün imam ehsanı verirdi.* Ə.Haqverdiyev. [Qızxanım] *məhərrəm ayı olduğu üçün qara don geymişdi.* Çəmənzəminli.

2. Bax **məhərrəmlik**. *Zibəs ki, girya eylər gözlərim guya məhərrəmdir.* S.Ə.Şirvani.

**MƏHƏRRƏMLİK** *is. din.* Məhərrəm ayında imamların qətli münasibətilə şiələrin tutduqları yas, saxladıqları matəm; təziyə, əza. *Məhərrəmlikdə kərbəlayı altıaylıq uşaqların başını çərtirdi.* Çəmənzəminli. [Qərib:] *Məhərrəmlikdə şəbih çıxardırlar, ey, birinə yezid paltarı geydirirlər, birinə imam paltarı!* Ə.Əbülhəsən.

**MƏHFƏL** *is.* [*ər.*] *köhn.* 1. Yığıncaq yeri.

2. Toplantı, dərnək.

**MƏHFƏZƏ** *is.* [*ər.*] *köhn.* 1. Qab, mücrü, sandıqça.

2. Qılaf.

**MƏHKƏMƏ** *is.* [*ər.*] 1. Cinayət işlərinə və mülki mübahisələrə baxan ədliyyə orqanı. *Xalq məhkəməsi. Ali məhkəmə.* // Bu orqanların heyəti. *Qalxın, məhkəmə gəlir! Məhkəmə işə baxdı.*

2. Bu orqan tərəfindən işə baxılma. *Məhkəmə iclası. Məhkəmədə çıxış etmək.* – [Qulu:] *..İcazə ver, bunu məhkəməyə verim, mən belə təhqirlərə dözə bilmərəm.* İ.Əfəndiyev. // Bu orqanın iclası. *Məhkəmə iki saat çəkdi.*

3. İctimai qaydanı pozanların, yaxud yaramaz hərəkət edənlərin işinə baxmaq üçün hər hansı bir kollektivin üzvləri tərəfindən seçilmiş ictimai orqan, habelə belə işlərə baxma. *Yoldaşlıq məhkəməsi.*

**MƏHKƏMƏBAZ** *is.* [*ər.* məhkəmə və *fars.* ...baz] Vaxtını məhkəmələrdə keçirməyi, hər bir iş üçün məhkəməyə müraciət etməyi sevən adam.

**MƏHKƏMƏBAZLIQ** *is.* Məhkəməbaz adamın xasiyyəti.

**MƏHKƏMƏLİK** *sif.* Məhkəməyə aid olan, məhkəmə vasitəsilə həll edilməli olan.

**MƏHKUM** *sif.* [*ər.*] 1. Haqqında məhkəmə tərəfindən hökm çıxarılmış, hər hansı bir cəzaya məhkum edilmiş. ☐ **Məhkum etmək** – haqqında hər hansı bir cəza hökmü çıxarmaq, cəza vermək. *Ağır cəzaya məhkum etmək. – ..Belə ki, onu* [məhkəmə] *öz kəndindən Şamaxıya köçürüb orada həmişəlik yaşamağa məhkum edibdir.* C.Məmmədquluzadə. **Məhkum olmaq** – məhkəmə tərəfindən müəyyən cəza almaq. *Həbsə məhkum olmaq. – Məhkum olmuş bir canitək; Ağlayırdı yalvararaq.* N.Rəfibəyli. // *İs. mənasında.* Dustaq, məhbus. *Beş dəqiqə sonra məhkumlar bir-bir danışdırılıb keçdilər.* H.Nəzərli. *Nökərlər xanın əmrilə bir məhkumu gözünü çıxarmaq üçün çəkə-çəkə meydana gətirdilər.* Ə.Sadıq.

2. *məc.* İtaət altında olan, asılı vəziyyətdə olan; hüquqsuz, tabe. *Bakıda da qadınlar dörd divar arasında məhkum, məzlum, avam və cahil bir halda yaşayırdılar.* H.Sarabski. *O, əzilən, məhkum ərəb deyil, artıq; O da çoxdan ayılmış!* B.Vahabzadə. ☐ **Məhkum etmək** – itaət altına almaq, tabe etmək, asılı etmək. [Kamran:] *Bunları bir də məhkum etmək mümkün deyildir.* H.Nəzərli. **Məhkum olmaq** – itaət altına alınmaq, tabe edilmək. *Məhkum olmuş xalqlar.*

3. Məhvi, həlakı, yaxud iflası, pis gələcəyi labüd olan. *Məhvə məhkum. – Əmək pərisi munisdi hər gəncə, hər ixtiyarə; İşsiz qalanlar, şübhə yox, məhkum idi səfalətə.* H.Cavid. *Gözəllik bir çiçək, məhkum solmağa; Soldurma boş yerə sən onu, gəlin!* Ə.Cavad.

**MƏHKUMİYYƏT** [*ər.*] b a x **məhkumluq** 2-ci mənada. *Məhkumiyyət sözünü dünya tarixindən; Silmək istəyirəm mən.* M.Dilbazi.

**MƏHKUMLUQ** *is.* 1. Etdiyi cinayətə görə məhkəmə cəzası alma. *Məhkumluğun götürülməsi haqqında fərman.*

2. Məhkum olma, itaətdə, asılı vəziyyətdə qalma; asılılıq, tabelik, əsarət. *Getdikcə Mirzə Valeh bir asılılıq, bir məhkumluq hiss edirdi.* S.Rəhimov.

3. Məhkum (3-cü mənada) adamın hal və vəziyyəti.

**MƏHLİQA** b a x **mahliqa**. *Vaqifa, bir məhliqayi-mehribanə meyil qıl; Ta kəmali-eşqə ondan zərrə nöqsan olmaya!* M.P.Vaqif.

**MƏHLUL** *is.* [*ər.*] Bərk və ya duru maddənin suda və ya başqa bir mayedə həll olunması nəticəsində alınan eynicinsli duru maddə. *Dərman məhlulu. Marqanes məhlulu.* // Müxtəlif maddələrin yekcins, xəmirə oxşar qatılığı. *Əhəng məhlulu. – Aydın xüsusi məhlulla sovxoz işçilərinin evlərini dezinfeksiya eləməyə başladı.* H.Seyidbəyli. [Lalənin] *tuflisi və tumanı gil məhlulundan ləkə-ləkə olmuşdu.* M.Hüseyn.

**MƏHLULQARIŞDIRAN** *is. xüs.* Məhlulu qarışdırmağa məxsus maşın, cihaz. // Sif. mənasında. *Məhlulqarışdıran maşın.*

**MƏHLULLU** *sif.* Məhlul qarışıqlı, məhlulu olan.

**MƏHPARƏ** b a x **mahparə**. *Qəm alıb könlümü, çəkir zülmətə; Ta gəlməsə o məhparə xəbər ver.* Aşıq Ariz.

**MƏHRƏBA** *is.* Dəsmal. *Bayraməli bəy daxil olur, ayağında çust, əlində məhrəba, başıaçıq, acıqlı ətrafa baxır.* N.Vəzirov. *Qızxanım nənə stəkanları təmiz ağ məhrəba ilə silə-silə* [Almuradın] *sözünü kəsdi.* İ.Əfəndiyev.

**MƏHRƏM** *sif.* və *is.* [*ər.*] 1. Çox yaxın sayılan, yaxın dost sayılan; sirdaş. *O gedəndən bəri bir məhrəmim yox; Ləzzətim yox, söhbətim yox, dəmim yox.* Q.Zakir. [Mirzə Heydər:] *Əlbəttə, gərək heç bir şey gizləməyəsən. Çünki biz məhrəmik.* Ə.Haqverdiyev. ☐ **Məhrəm olmaq** – yaxın olmaq, sirdaş olmaq. *Nə könlüm açılar, nə üzüm gülər; Səgrəqibə məhrəm olandan bəri.* Q.Zakir. *Rəhim bəy və Səlim bəy Hüseynqulu ağanın ailəsinə məhrəm olduqları üçün onları sakit etməyə getdilər.* S.S.Axundov.

2. Yaxın qohum olduqlarına görə izdivacları şərən haram və qadağan olan, buna görə də bir-birindən qaçınması lazım gəlməyən (qadın-qız və kişi). *Dayı bacıqızıya məhrəmdir.* ☐ **Məhrəm etmək** – yaxın etmək, evləndirmək. [Həmzə Axunda:] *Mən xahiş etmək istəyirəm ki, iki qulbeçənizi bir-birinə məhrəm edəsiniz.* C.Cabbarlı. **Məhrəm olmaq** – yaxın olmaq, evlənmək. [Kərbəlayı Nəbi:] *İndi gərək .. biz bir-birimizə məhrəm olaq.* S.S.Axundov.

3. Gizli. *Bədənin məhrəm yerləri.*

**MƏHRƏMANƏ** *zərf* [*ər.* məhrəm və *fars.* ...anə] 1. Yaxın adam kimi, çox yaxın dost kimi; dostyana.

2. Gizlicə, gizli-gizli. *O gül camalına mən aşiq olmasaydım əgər; Fəqani-bülbülə çox məhrəmanə baxmaz idim.* Ə.Vahid.

**MƏHRƏMLİK** *is.* Yaxınlıq, dostluq, sirdaşlıq.

**MƏHRUM** *sif.* [*ər.*] Nəsibi, hissəsi, payı olmayan; nəsibsiz. *İstedaddan məhrum bir adam. Bilikdən məhrum. – Ruhnəvaz gözəl deyil idi, nəşəli təbiətdən məhrumdu..* Çəmənzəminli. ◻ **Məhrum etmək (qılmaq)** – binəsib etmək, birinin əlini boşa çıxarmaq, bir şeyi əlindən almaq. *Qılma Ələsgəri məhrumi-didar; Tərəhhüm et mənə bir busə, ey yar!* Aşıq Ələsgər. [Şeyx Sənan dərvişə:] *Baba dərviş! Qılmayın lütfən; Bizi məhrum feyzi-söhbətdən.* H.Cavid. **Məhrum olmaq** – binəsib olmaq, əlindən çıxmaq, əli boş qalmaq, əli çıxmaq. [Dostəli:] *..Hərgah ləziz taamdan məhrum olmaq istəmirsənsə, sən də tez ol, get, ondan xörək al, ye*. Ü.Hacıbəyov. *Qətibənin çöhrəsi öz arzu və əməlindən məhrum olan qızın çöhrəsinə bənzəyirdi.* M.S.Ordubadi. // Xəbər şəkilçisi ilə: **məhrumdur** – yoxdur, malik deyil. *Bu yerlər bitkidən məhrumdur.* – [Firiduna] *elə gəlirdi ki, qadın nəvazişi və məhəbbətilə isinməyən bir qəlb səadətdən məhrumdur*. M.İbrahimov.

**MƏHRUMİYYƏT** *is.* [*ər.*] 1. Məhrum olma, binəsib olma, əli boşda qalma; binəsiblik, nəsibsizlik.

2. Ehtiyac. *Siz .. aclığa və məhrumiyyətə qarşı sinənizi gərən təbrizlilərsiz*. M.S.Ordubadi.

**MƏHRUMLUQ** *is.* Məhrum olma; nəsibsizlik.

**MƏHSUL** *is.* [*ər.*] 1. Torpaqda yetişdirilən taxıl, meyvə, tərəvəz və s. *Məhsul yığımı. Buğda məhsulu. Üzüm məhsulu. Pambıq məhsulu. – Bahar yağıntılı keçdiyindən məhsul gözlənildiyindən qat-qat artıq olmuşdur.* M.Rzaquluzadə. *İndi məhsulun müqəddəratı əkini vaxtlı-vaxtında suvarmaqdan asılı idi.* Ə.Sadıq.

2. Adətən cəm şəklində: **məhsullar** – istehsal edilən yeyiləcək və içiləcək şeylər, qida şeyləri. *Süd məhsulları. Balıq məhsulları. Ət məhsulları.*

3. Sənayenin hazırladığı müxtəlif şeylər. *Fabrikin məhsulu. Məhsulun keyfiyyəti.*

4. Bir şeyin törədiyi nəticə, bir şeyin nəticəsində hasil olan şey. *Əsər gərgin əməyin məhsuludur. İnsan mühitin məhsuludur. – Qəhrəmanlıq bir xalqın mədəni və siyasi səviyyəsinin qiymətli məhsuludur*. M.S.Ordubadi. ◻ **Məhsul olmaq** *klas.* – yetişmək, çatmaq, ələ gəlmək, hasil olmaq. *Nə üçün biz verək bu barədə pul; Bizə bundan nə xeyir olur məhsul?* S.Ə.Şirvani.

**MƏHSULAT** *top.* [*ər.* "məhsul" söz. cəmi] İstehsal olunan, əldə edilən, hasil edilən məhsulun məcmusu. *Neft məhsulatı. – Yığılır hər tərəfdə məhsulat; Saxlanır anbar içrə məkulat.* A.Səhhət. *..Yüksək daş körpü üstündə dayanıb ətrafdan şəhərə ərzaq və bostan məhsulatı gətirən kirəçiləri seyrə dalmışdım*. S.Hüseyn.

**MƏHSULDAR** *sif.* [*ər.* məhsul və *fars.* ...dar] 1. Çox məhsul verən; məhsullu, münbit, bərəkətli. *Məhsuldar torpaq. – Ucu-bucağı görünməyən .. məhsuldar çöllər yorulmadan və inadla çalışan insanlarla doludur.* M.İbrahimov.

2. Çox bar verən; gəlirli, xeyirli. *Məhsuldar çay növü. Məhsuldar arı cinsi.*

3. Qiymətli şeylər yaradan, istehsal edən. *Məhsuldar əmək.* // Çox məhsul istehsal edən, yaxşı işləyən. *Məhsuldar fəhlə. – Ona elə gəlirdi ki, insanlar heç bir zaman indiki qədər məhsuldar* (z.) *işləməmişlər.* Mir Cəlal.

4. *məc.* Çox əsər yazan, çox yaradan, yaradıcılıq məhsulu çox olan. *Məhsuldar alim. Məhsuldar yazıçı.*

5. *dilç.* İndi də işlənən, yeni sözlər düzəltmə imkanı verən. *Məhsuldar şəkilçilər. Məhsuldar formalar.*

◊ **Məhsuldar qüvvələr** *iqt.* – maddi nemətlər istehsal etmək üçün alətlər və onları işlədib maddi nemətlər istehsal edən adamlar.

**MƏHSULDARLAŞDIRMA** "Məhsuldarlaşdırmaq"dan *f.is.*

**MƏHSULDARLAŞDIRMAQ** *f.* Daha da məhsuldar etmək, məhsul vermək qabiliyyətini artırmaq. *Əməyi məhsuldarlaşdırmaq.*

**MƏHSULDARLAŞMA** "Məhsuldarlaşmaq"dan *f.is.*

**MƏHSULDARLAŞMAQ** *f.* Daha da məhsuldar olmaq, məhsuldarlığı artmaq. *İstehsal qüvvələri dəyişir, əmək məhsuldarlaşır.* Mir Cəlal.

**MƏHSULDARLIQ** *is.* Məhsul vermə qabiliyyəti, bol məhsul vermə. *Kənd təsərrüfatı bitkilərinin məhsuldarlığı. Məhsuldarlıq planını yerinə yetirmək.* – [Qocalar] *məhsuldarlıqdan, əmək günlərindən söhbət açırlar.* S.Rüstəm.

**MƏHSULLU** b a x **məhsuldar** 1 və 2-ci mənalarda. *Məhsullu yer. Məhsullu il. – Gərək burada gözəl və məhsullu bağlar olsun..* H.Nəzərli. *Hamı təzədən bağçalarını güllü, ağaclarını meyvəli, tarlalarını məhsullu* (z.) *görmək istədi.* Ə.Məmmədxanlı.

**MƏHSULLULUQ** b a x **məhsuldarlıq**.

**MƏHSULSUZ** *sif.* Məhsulu olmayan. *Məhsulsuz il.* // Qeyri-münbit, məhsul verməyən; bərəkətsiz. *Məhsulsuz yerlər.*

**MƏHSULSUZLUQ** *is.* Məhsulun olmadığı hal; qıtlıq, bərəkətsizlik. *Torpağın məhsulsuzluğu.*

**MƏHSULVERİCİ** b a x **məhsuldar** 1-ci mənada.

**MƏHŞƏR** [*ər.*] 1. B a x **qiyamət** 1-ci və 3-cü mənalarda. *Vaqifəm, hicrandır mənim məhşərim; Gecə-gündüz canan olmuş əzbərim.* M.P.Vaqif. [Şahpəri:] *Vallah, bir tufan var, bir qiyamət qopur ki, elə bil məhşərdir!* B.Bayramov. ☐ **Ərəsati-məhşər** – b a x **ərəsat**.

◊ **Məhşər ayağına çəkmək** – bərk sıxışdırmaq, sorğu-suala çəkmək, haqq-hesab tələb etmək. *İki mələk Həsəni darta-darta məhşər ayağına çəkir.* S.Rəhman. **Məhşər qopmaq** – b a x **qiyamət qopmaq** ("**qiyamət**"də). *Əzizinəm yad əli; Ya divanə, ya dəli; Məhşərim o gün qopar; Yara dəysə yad əli.* (Bayatı). *Sənsiz vətəndə bir qəribəm, qan olur könül; Məhşər qopar başımda, xuruşan olur könül.* A.Səhhət. **Məhşər qurulmaq** – dava-qalmaqal, mərəkə qopmaq; çaxnaşma, vurhavur başlanmaq. *Yığılsa məxluqat, qurulsa məhşər; İsrafil surunu çala, qoymaram.* "Koroğlu".

**MƏHV** *is.* [*ər.*] Yox etmə, ortadan qaldırma, tələf etmə, puç etmə, məhvinə səbəb olma. ☐ **Məhv etmək** – yox etmək, puç etmək, tələf etmək, qırmaq. *Siçanları məhv etmək. Həşəratı məhv etmək. Müharibə milyonlarla adamı məhv etdi.* **Məhv olmaq** – 1) yox olmaq, yer üzündən silinib getmək. *Minlərcə adam odlu gürzələrin cənginə düşüb məhv olmaqda idi.* Çəmənzəminli; 2) puç olmaq, yoxa çıxmaq, heçə çıxmaq. *Ümidləri məhv oldu.*

**MƏHVEDİCİ** *sif.* Məhv edən, yox edən, tələf edən; məhv etməyə qadir olan, dağıdıcı. *Məhvedici atəş. Məhvedici təbii fəlakət. Məhvedici zərbə.*

**MƏHVEDİLMƏZ** *sif.* Məhv edilməsi mümkün olmayan, yox edilə bilməyən. *Materiyanın hərəkəti və inkişafı əbədi olduğu kimi, ziddiyyətlərin mübarizəsi, köhnə ilə yeninin mübarizəsi qanunu da əbədidir, məhvedilməzdir.* (Qəzetlərdən).

**MƏHZ** *əd.* [*ər.*] Özündən sonra gələn sözü gücləndirir, nəzərə çarpdırır, ayırır; ancaq, yalnız, tək, təkcə, şübhəsiz, buna görə də. [Molla Həmid:] *Hələ buyurun görək, zəhmət çəkməyinizdən qərəz məhz o cənabın ziyarətidir, ya başqa bir məramınız dəxi var?* M.F.Axundzadə. [Rəşid:] *..Çünki dediyim sirrin izahı məhz həmin gündən başlandı.* S.Hüseyn.

**MƏHZƏN** *klas.* b a x **məhz**.

**MƏHZƏR** *is.* [*ər.*] *köhn.* 1. Hazır olma.

2. Yığıncaq.

3. Cəmiyyət.

4. Akt, protokol.

**MƏHZUN** *sif.* [*ər.*] Hüznlü, həzin, kədərli, qəmli, məlul, dərdli. *Hüsaməddin baş endirib durdu, Qətibə isə qara və məhzun baxışlı gözlərini ona tərəf çevirdi.* M.S.Ordubadi. [Dərviş:] *Ruqiyyə məlul və məhzun* (z.) *evə getdi.* A.Divanbəyoğlu. *Qız məhzun baxışlarını* [Aqilin] *üzündən çəkmədən yenə də başını yırğaladı.* Q.İlkin. ☐ **Məhzun etmək** – kədərləndirmək, qüssələndirmək. *Şad ikən bu söz ilə könlümü məhzun etdin.* Füzuli. *Gülməgində qanlı-qanlı giryələr; Hər müsəlman könlünü məhzun edər.* A.Səhhət. **Məhzun olmaq** – qəmlənmək, kədərlənmək, qüssələnmək. *Gördü nazik ayağın ol dilxun; Tutulub könlü, oldu çox məhzun.* S.Ə.Şirvani.

**məhzun-məhzun** *zərf* Kədərli-kədərli, həzin-həzin; qüssəli, kədərli. *..Kölgə bu yandan qaçıb, o biri tərəfdə lal-mat durub məhzun-məhzun Nadirin üzünə baxırdı.* B.Talıblı. *Qızarmış gözlər məhzun-məhzun intizarlı baxışlarla ətrafa nəzər yetirirdi.* Ə.Vəliyev.

**MƏHZUNANƏ** *sif.* [*ər.* məhzun və *fars.* ...anə] Məhzun, qüssəli, qəmli, kədərli. *Məhzunanə baxış.* // *zərf* Məhzun-məhzun, hüznlə. *Məşədi Heydərəli və onun arvadı Bədirnisə oturublar yan tərəfdə, Nadirquluya məhzunanə baxırlar.* M.Əliyev.

**MƏHZUNLUQ** *is.* Məhzun olma; qüssəlilik; hüzn, kədər, qəm, qüssə. [Qızın] *qara ipək çadrası altında açıq buraxdığı üzündə bir məhzunluq hiss edilirdi.* S.Hüseyn. [Axund] *səsinə bir məlahət, bir məhzunluq verməyə çalışdı*. Q.Qantəmir. *Yemək gəldi, toplandılar süfrəyə; Aralıqda gəzirdi bir məhzunluq.* M.Müşfiq.

**MƏXARİC** *is.* [*ər.* "məxrəc" söz. cəmi] Çıxar (*mədaxil* əksi). *Kəndin mədaxili məxaricindən azdır.* M.S.Ordubadi. [Daşdəmir Yusifə:] – *..Keçən il bostandan gələn pulu yoxlamaq, necə mədaxil olduğunu, hara məxaric olduğunu bilmək lazımdır.* B.Bayramov.

**MƏXƏZ** *is.* [*ər.*] 1. Bir şeyin alındığı yer, əsil yeri; mənbə.

2. *xüs*. Elmi tədqiqatın əsaslandığı yazılı abidə, sənəd, əsər və s.; mənbə. *Tarixi məxəzlərdən istifadə etmək. – Başqa məxəzlərdə Naxçıvanın bu dövrdə ən gözəl şəhərlərdən biri olduğu qeyd edilir.* (Qəzetlərdən).

**MƏXFİ** *sif.* və *zərf* [*ər.*] 1. Gizli, gizlicə, xəlvəti. *Məxfi demək.* – [Dostum] *məxfi şeylər danışırmış kimi qulağıma əyildi.* Mir Cəlal. [Qədir] *nə qədər məxfi söz danışır danışsın, üç ağaclıqdan eşidilirdi.* İ.Əfəndiyev. ◻ **Məxfi qalmaq** – gizli saxlanmaq, başqası bilməmək, gizli qalmaq, aşkar edilməmək. *Bəli, bu iş gərək məxfi qala.* C.Məmmədquluzadə. [Əmir Aslan ağa:] *O da məxfi qalmasın ki, hər kim mənim əmrimdən baş qaçırarsa, güllə qabağına qoyulacaqdır.* S.S.Axundov. **Məxfi saxlamaq (tutmaq)** – gizli saxlamaq, başqasına deməmək, başqalarından gizlətmək. [Şeyx Sənan:] *Təbii, səndə var bir xeyli əsrar; Neçin məxfi tutar, qılmazsan izhar?* H.Cavid.

2. Geniş surətdə yayılmasına icazə verilməyən, gizli qalmalı olan, gizli saxlanılan. *Bu əski qəza* [idarəsinin] *məxfi arxivindən çıxarılmış bir iş idi.* H.Nəzərli. *Kosa, Sübhanverdizadənin söylədiyindən, bu kassanın məxfi kağızlar üçün olduğunu yaxşıca bilirdi.* S.Rəhimov.

3. **Məxfidir** şəklində *rəs.* – gizli, məxfi saxlanılmalı olan sənəd, məktub və s.-nin üzərində yazılan qeyd.

**MƏXFİLİK** *is.* Məxfi şeyin hal və keyfiyyəti. *Məktubun, xəbərin məxfiliyi.*

**MƏXLƏS** *ara s.* [*ər.*] Müxtəsər, sözün qısası, xülasə. *Məxləs, Nəbigil Qazangöldə Xocahan bəylərini tamam şil-küt eləyib qovladılar.* "Qaçaq Nəbi".

**MƏXLUQ** *top.* [*ər.*] 1. Canlı varlıq, canlı vücud (insan, heyvan). *Müsəlmanın təsəvvüründə .. şeytan hiyləgər məxluqdur, başında bir taskülah var..* C.Məmmədquluzadə. *Lakin insan müstəsna bir məxluqdur.* Mir Cəlal. [Xanın] yuxuda *gördüyü qorxunc məxluqlar yadına düşdü.* M.Rzaquluzadə.

2. Xalq, camaat, el, adamlar. [İmamyar:] *Məxluq çalıb-oynayır..* C.Cabbarlı. [Hüseyn:] *Dayı! Nə üçün məxluqu yığmısınız bizim qapımıza?* S.Rəhman.

3. "Adam, insan" mənasında. *Ah, ana! Sən nə qədər böyük məxluqsanmış!..* M.Hüseyn.

**MƏXLUQAT** [*ər.* "məxluq" söz. cəmi] *klas.* bax **məxluq** 1 və 2-ci mənalarda. *Külli-məxluqat yığıla; Çətindi sevdam dağıla..* "Koroğlu". *Əcaib məxluqat görünürdü, .. kimi buynuzlu və at ayaqlı idi, bəzisi yarı öküz, yarı adam idi.* Çəmənzəminli.

**MƏXLUT** *is.* [*ər.*] *köhn*. Qarışıq, xəlitə.

**MƏXMƏR** *is.* [*ər.*] Üzü qısa xovlu parlaq ipək parça. [Əsgər:] *Çit, ipək, məxmər, bafta, tafta... hər şeyim var.* Ü.Hacıbəyov. // Məxmərdən tikilmiş, məxmərdən olan, üzünə məxmər çəkilmiş. *Məxmər döşək. Məxmər pərdə. – Abı ipək don geymiş qarabəniz xanım yaşıl məxmər divanda böyrü üstə uzanıb .. oxuyurdu*. M.S.Ordubadi. *Dəmirov astarsız məxmər pencəyini düyməl变di.* S.Rəhimov. ◻ **Məxmər kimi** – görünüşcə və ya əl vuranda məxməri xatırladan şey haqqında. *Yaşıl məxmər kimi döşəndi yonca; Vətən qızlarının*

*ayaq altına.* S.Vurğun. *..Məxmər kimi otların arasından büllur sular süzülür, qönçələrə, düyməçələrə parlaq incilər düzülürdü.* M.Rzaquluzadə.

**MƏXMƏRƏK** *is.* [*ər.* məxmər və *fars.* ...ək] *tib.* Qırmızı səpki şəklində yoluxucu uşaq xəstəliyi.

**MƏXMƏRGÜLÜ** *is. bot.* Qırmızı rəngli, topləçəkli bir gül. *Bu yerlərdə nə istəsən taparsan: sarmaşığımı, dəvəçiçəyinimi, məxmərgülünümü, dağlaləsinimi deyim, hansı birisini deyim?* Mir Cəlal.

**MƏXMƏRİ** *sif.* [*ər.*] Məxmərə oxşar, məxmər kimi; zərif, yumşaq. *Məxməri ot.* – *Məxməri ormanlarda çiçək dərdiyin yerdə; Baxarsan, çiçəklər var, açar kölgəliklərdə.* Ə.Cavad. ☐ **Məxməri bənövşə** *bot.* – bənövşənin bir növü. [Ceyran xala:] *Gör nə qədər məxməri bənövşə əkmişəm?* S.Rəhman. **Məxməri çay** – tünd, ətirli çay. *Kərim .. məxməri çayı qabağına çəkdi.* M.İbrahimov. [Qaçay:] *Elə isə bir stəkan məxməri çaydan! – Oldu?* Z.Xəlil.

**MƏXMƏRLİ** *sif.* 1. Məxmərlə örtülmüş, üzərinə məxmər çəkilmiş. *Məxmərli divan.* – [Qurban] *müvazinətini saxlamaq üçün göy məxmərli yazı stoluna söykəndi.* M.Hüseyn. [Nazlı:] *Teatrda məxmərli eyvanda oturub,* "*Əsli-Kərəm*"*ə baxacağıq.* Ə.Məmmədxanlı.

2. B a x **məxməri**. *Üfüqdə başı qarlı, döşləri, ətəkləri sarımtıl-yaşıl məxmərli dağlar baxışları oxşayırdı.* M.Rzaquluzadə.

**MƏXRƏC** *is.* [*ər.*] 1. *riyaz.* Kəsrdə vahidin neçə hissəyə bölündüyünü göstərən ədəd. *Kəsrin məxrəci. Surət və məxrəc.*

2. *dilç.* b a x **artikulyasiya**. *Saitlərin məxrəci.*

**MƏXSUS** *sif.* [*ər.*] 1. Yalnız birinə aid olan. *Mənə məxsus. Özünə məxsus. Tələbəyə məxsus.* // Xas olan. [Mirzağanın] *özünə məxsus bir əxlaq və təbiəti, bir düşüncəsi vardı.* S.Hüseyn. [Kərim baba] *..uşaqlara məxsus bir sevinclə sümsünü iri dodaqları arasına qısıb çalmağa başladı.* A.Şaiq.

2. *zərf* Xüsusi olaraq, ayrıca. *Mən bu sözləri məxsus sənə danışıram. O, məxsus mənim üçün gəlmişdi. – Bu pul ilə sən özün üçün məxsus bir alış-veriş aça bilərsən.* Ə.Haqverdiyev.

**MƏXSUSƏN** [*ər.*] 1. B a x **məxsus** 1-ci mənada.

2. Xüsusi olaraq, qəsdən, bilə-bilə. *O, məxsusən belə edir.*

**MƏXSUSİ** [*ər.*] *sif.* və *zərf* 1. Ancaq bir şeyə və ya bir şəxsə aid olan, məxsus olan; xüsusi. *Məxsusi yer. Məxsusi paltar. – Qız evindən bəy üçün məxsusi bəy xonçası gəlir.* R.Əfəndiyev.

2. Ayrıca olaraq, ayrılıqda, xüsusi surətdə. *Məxsusi danışmaq. Məxsusi görüşmək.*

**MƏXSUSİYYƏT** *is.* [*ər.*] Məxsus olma, aid olma; aidiyyət, xüsusiyyət.

**MƏİŞƏT** *is.* [*ər.*] 1. Ümumi yaşayış tərzi; yaşayış, yaşama, həyat. *Kino məişətimizə möhkəm surətdə daxil olmuşdur. Yeni məişət uğrunda mübarizə.* – [Zeynal] *get-gedə məişət pozğunluğunun çirkabı içinə yuvarlanırdı.* S.Hüseyn. [Dərviş:] *Dayı, bir az da qal, şəhər məişətinə isinişərsən.* A.Divanbəyoğlu.

2. Dolanacaq, güzəran, zindəganlıq. *Biz gərək səy edək məişət üçün; Sənətü kəsb üçün, ziraət üçün.* S.Ə.Şirvani. *Mirzənin məişəti ağır olduğundan məktəb nəzdində olan cəmiyyəti-xeyriyyə onun uşaqlarını dərs pulundan azad etmişdi.* Ə.Haqverdiyev. ☐ **Məişət keçirmək** – güzəran keçirmək, həyat sürmək, dolanmaq. *..Bircə Usta Ağabala qədimliyində sabit qalıb, otuz il idi ki, bu qərar ilə məişət keçirirdi.* Çəmənzəminli.

**MƏİŞƏTÇİLİK** *is. dan.* İctimai həyatdan uzaqlaşıb bütün fikrini öz yaşayışına, həyatına vermə.

**MƏİYYƏT** *is.* [*ər.*] *kit.* Böyük vəzifəli şəxsi müşayiət edən heyət. *Çar konsulu öz dostlarını vəliəhdin məiyyəti içərisində aramağa başlamışdı.* M.S.Ordubadi.

**MƏKAN** *is.* [*ər.*] 1. Bir adamın, şeyin sakin olduğu yer, oturulan yer; yurd. [Ağa Salman:] *O sərbazların adı və məkanı sizə məlumdurmu?* M.F.Axundzadə. *Görürəm mən yuxuda hər axşam; O mübarək məkanı çox sevirəm.* A.Səhhət. // Ümumiyyətlə, yer. *Qərib-qərib, qəmgin-qəmgin ötərsiz; Üz tutubsuz nə məkana, durnalar!* M.V.Vidadi.

2. *fəls.* Materiyanın varlığının, həcm və ölçü ilə səciyyələnən əsas ümumi obyektiv formalarından biri. *Məkan və zaman kateqoriyası.*

**MƏKANSIZ** *sif.* Məkanı, yeri, yurdu olmayan; yersiz-yurdsuz. *Lətif zara gəlmiş bir məkansız quş; Pünhan sirr içində olubdu bihuş.* "Lətif şah".

**MƏKƏ, MƏKƏBUĞDASI** *is.* Qarğıdalı, peyğəmbəri.

**MƏKƏRƏ** *is.* [*rus.* "yarmarka"dan] 1917-ci il inqilabından əvvəl azərbaycanlılar Nijni-Novqorod şəhərində hər il keçirilən yarmarkanı bu cür adlandırardılar.

**MƏKİK** *is.* 1. Tikiş maşınında: altdakı sapın çıxması üçün kəsici alət, mexanizm. *Əl maşınının məkiki.*

2. Toxucu dəzgahında: arğac kimi işlədilmək üçün iplik sarınan uzunsov oval qutu və ya qəlib şəklində alət. *Dəzgahın məkiki.*

**MƏKR** *is.* [*ər.*] Hiylə, biclik, kələk. [Vəzir:] *Ay ləçər, bu necə məkrdir mənim başıma gətirirsən?* M.F.Axundzadə. [Bəhram:] *Madam ki, bütün insanlar məkr və təzvir ilə öz məqsədlərinə yetişirlər, nə səbəbə mən hiylə qarşısında hiylə işlətməyim?* C.Cabbarlı. ◻ **Məkr etmək (eləmək)** – hiylə işlətmək, hiylə etmək, aldatmaq. *Nigar pəncərədən baxar; Məkr eləyər, evim yıxar.* "Qurbani".

**MƏKRLİ** *sif.* Hiyləli, hiyləgər, aldadıcı.

**MƏKRUH** *sif.* [*ər.*] 1. İkrah doğuran, nifrət doğuran; iyrənc, mənfur, çirkin. *Məkruh səs.* – [Qurban:] *Nə qədər xasiyyətdən yaxşıdırsa, bir elə sifətdən məkruhdur.* Ə.Haqverdiyev.

2. Müsəlman dininə görə haram sayılmasa da, zəruri ehtiyac olmadan yeyilməsi məsləhət görülməyən şey. [Ata:] *Oğlum, dovşan ətini, at ətini peyğəmbərimiz məkruh buyurmuşlar.* S.S.Axundov.

**MƏKTƏB** *is.* [*ər.*] 1. Yetişməkdə olan nəslə təlim və tərbiyə verən təlim-tərbiyə müəssisəsi. *Məktəbə getmək. Məktəbdə oxumaq. Məktəbi qurtarmaq.*

2. Hər hansı bir xüsusiləşdirilmiş tədris müəssisəsi. *Musiqi məktəbi. Hərbi məktəb.* – *Mirzə Səfərin iki oğlu ədliyyə məktəbinin beşinci sinfində oxuyurdu.* Ə.Haqverdiyev. *Cuma İmanzadə 1922-ci ildə Bakıda hərbiyyə məktəbini bitirmişdi.* Ə.Əbülhəsən.

3. Təhsil sistemi, tədris müəssisələri toplusu. *Məktəbin politexnikləşdirilməsi.*

4. *məc.* Öyrənmə, təcrübə qazanma, habelə əldə edilmiş təcrübənin özü; bilik, təcrübə. *Həyat məktəbi. Yaxşı məktəb keçmək.*

5. Elmdə, incəsənətdə, ədəbiyyatda, habelə ictimai-siyasi fikirdə bu və ya başqa fərqli xüsusiyyətləri olan cərəyan; məslək. *Müxtəlif məktəblərə mənsub rəssamlar. Mollanəsrəddinçilər məktəbi.* – *Cəlil Məmmədquluzadə XX əsr Azərbaycan ədəbiyyatında tənqidi realizm məktəbinin başında dururdu.* M.İbrahimov.

**MƏKTƏBÇİ** *köhn.* bax **məktəbdar**. *Bir belə söz də deyirlər ki, sizin kalba Aşır; Yeni məktəbçilər ilə gecə-gündüz yanaşır.* M.Ə.Sabir.

**MƏKTƏBDAR** *is.* [*ər.* məktəb və *fars.* ...dar] *köhn.* Keçmişdə xüsusi məktəb açıb orada dərs deyən adam. *..Övladımızın tərbiyə və təlimi bilkülliyə üsuli-təlimdən bixəbər və adabi-tərbiyədən bihiss olan məktəbdarların əlində idi.* F.Köçərli.

**MƏKTƏBDARLIQ** *is. köhn.* Məktəbdarın işi; öz xüsusi məktəbində dərs demə. *Mirzə Həsən Təbrizdə məktəbdarlıq etdiyi müddətdə vəliəhd Müzəffərəddin mirzəni çox yaxşı tanımışdı.* P.Makulu.

**MƏKTƏBDƏNKƏNAR** *sif.* Məktəbdə olmayan, məktəbdən kənarda olan, məktəbdən xaric həyata keçirilən (məşğələ, mədəni-maarif müəssisələri və s. haqqında). *Məktəbdənkənar tərbiyə müəssisəsi. Məktəbdənkənar məşğələ. Məktəbdənkənar iş.*

**MƏKTƏBƏQƏDƏR** *sif.* Uşağın məktəbə daxil olana qədərki dövrünə aid olan. *Məktəbəqədər uşaq müəssisəsi. Məktəbəqədər tərbiyə. Məktəbəqədər yaşlı uşaq.*

**MƏKTƏBXANA** *is.* [*ər.* məktəb və *fars.* ...xanə] *köhn.* Məktəb. *Məscid minarəsi, məktəbxanası; Torpağı şirindi, yeri yaxşıdır.* Aşıq Ələsgər. *Bizim Petrovski Akademiya bir böyük məktəbxanadır ki, əkin və ziraət, maldarlıq və meşə saxlayıb becərmək elmlərin təlim edir.* N.Vəzirov.

**MƏKTƏBLƏRARASI** *sif.* Bir neçə məktəb arasında olan, bir neçə məktəbə aid olan. *Məktəblərarası idman yarışı.*

**MƏKTƏBLİ** *sif.* Məktəbdə oxuyan; şagird. *Məktəbli uşaq.* – *Oturmuş qapıda məktəbli*

*bir qız; Əlində bir qələm, bir parça kağız.* S.Vurğun. // *İs. mənasında.* Məktəb şagirdi. *Məktəblilərlə görüş. – Məktəblilərin şən nəğmələri Qəhrəmanlar kəndini qaplayırdı.* Ə.Vəliyev. *Məktəblilər dəstə-dəstə; Doluşdu dərs otağına.* M.Dilbazi.

**MƏKTƏBYANI** *sif.* Məktəbin yaxınlığında, yanında olan. *Məktəbyanı bağça. – Bahar yaxınlaşırdı, uşaqlar məktəbyanı təcrübə sahəsində çoxlu bitki əkmişdilər.* Q.İlkin.

**MƏKTƏBYAŞLI** *sif.* Məktəbə girmək yaşı çatmış, həmin yaşda olan. *Məktəbyaşlı uşaq.* // İs. mənasında. *Məktəbyaşlıların siyahısını tutmaq.*

**MƏKTUB** *is.* [*ər.*] Hər hansı bir məqsədlə, yaxud bir şeyi xəbər verib bildirmək üçün yazılıb poçt və ya başqa vasitə ilə birinə göndərilən kağız. *Məktub göndərmək. Təcili məktub. – Məktubumu aldı, parə qıldı; Ağ üzünü dəxi qarə qıldı.* Xətayi. *Səfərlə Tanrıverdi Qurbanın paltarını yığışdırıb götürürkən arasından yerə bir məktub düşdü.* A.Şaiq.

**MƏKTUBLAŞMA** "Məktublaşmaq"dan *f.is.*

**MƏKTUBLAŞMAQ** *qarş.* Bir-birinə məktub yazmaq, bir-biri ilə yazışmaq. *Həmzə Rəcəbovun bir çox şəhərlərlə əlaqəsi vardı, çox adamlarla məktublaşırdı.* Ə.Əbülhəsən.

**MƏKTUBPAYLAYAN** *is.* Məktubları adreslər üzrə sahiblərinə çatdıran poçt işçisi; poçtalyon.

**MƏKULAT** *is.* [*ər.*] Yeyiləcək şeylər; azuqə, ərzaq. *Amma onun tamam məkulatı və məşrubatı haman mənzildə hazır olurdu.* M.F.Axundzadə. *Yığılır hər tərəfdə məhsulat; Saxlanır anbar içrə məkulat.* A.Səhhət.

**MƏKUS** *is.* [*ər.*] *köhn.* 1. Tərsinə düşmüş, başıaşağı çevrilmiş.

2. Nəyinsə əksi, ziddi, tərsi.

3. Əks-səda.

**MƏQALƏ** *is.* [*ər.*] Məcmuə, jurnal və ya qəzetdə kiçik elmi və ya publisistik yazı. *Qəzet məqaləsi. Tənqidi məqalə. Baş məqalə. –* "*Kəşkül*" "*Əkinçi*"*nin yolunu davam etdirərək, öz səhifələrində gerilik əleyhinə kəskin məqalələr dərc edirdi.* M.İbrahimov.

**MƏQAM** *is.* [*ər.*] 1. Yer, məkan. *Pişxidmətbaşı və Xacə Mübarək çıxdılar, hər birisi öz məqamına getdi.* M.F.Axundzadə. *Mənimçin kəbeyi-kuyündə, ey gül, bir məqam olmaz.* S.Ə.Şirvani. □ **Məqam etmək (tutmaq)** *klas.* – yer tutmaq, məskən salmaq. *Kim əski məqamımı unutdum; Sandım vətənim, məqam tutdum.* Füzuli. *Qoyma o dağılmışda məqam eyləsin oğlun! Sübhün belə viranədə şam eyləsin oğlun!* M.Ə.Sabir. // Yer, münasibət. *Məqamını bilmək* (*yerini bilmək*). *– Nə çığırbağır salırsan, yorulub usanmayırsan; Ədəb ilə öz məqamın tanıyıb dayanmayırsan.* M.Ə.Sabir. [Hacı:] *Siz öz məqamınızı bilirsiniz, ya yox?* Ə.Haqverdiyev. // Dərəcə. *..Dünyada xeyir iş görməyən adam heç məqamındadır.* Mir Cəlal.

2. Vaxt, zaman, çağ, münasibət. *Elə bir məqam və elə bir iş yadıma gəlmir ki, müsəlman intelligentləri orada qorxaqlıq büruzə verələr.* C.Məmmədquluzadə. *Ayrılıq məqamı halı pərişan; Qolunu boynuma salan yar hanı?* Aşıq Məmməd. □ **Məqam axtarmaq (güdmək)** – fürsət aramaq, imkan axtarmaq. *O yandan da məqam güdür talan olmuş fransızlar.* S.Vurğun. **Məqam tapmaq** – fürsət tapmaq, fürsətdən istifadə etmək. *Ürəyini boşaltmağa məqam tapdığı yerdə* [Həmişəyevi] *top gurultusu da susdura bilməzdi.* B.Bayramov. **Məqamı gəlmək** – zamanı gəlmək, vaxtı çatmaq, yeri gəlmək, münasibəti olmaq. // Fürsət, münasibət, vaxt. *Məqamdır, qoy desin nə həsrəti var.* M.Rahim.

3. Vəzifə, rütbə, mənsəb, mərtəbə. *Qubernator bizə bir neçə gözəl nəsihət elədi və bu da yadımdadı ki, dedi ki, kənd müəllimliyi bir ali məqamdır.* C.Məmmədquluzadə. [İskəndər bəy:] *Pərvərdigara, şükür, gündə min kərə şükür sənə ki, mən kimi yetimi bu məqama gətirdin.* N.Vəzirov. *Başını fırladar tutduğu məqam; Guya heç tanımır səni bu adam.* S.Rüstəm. □ **Məqama çatmaq** – 1) ...nə (bir) məqama çatıb ki..., nə yerə çatıb ki... (bir şeyin son, ifrat həddini göstərir). [Axund:] *A kişi, gör iş nə məqama çatıb ki, Qanqal Sadıq ilə Kaftar Tağı da uşaqlarını uşqolaya göndərirlər.* Ə.Haqverdiyev; 2) mənsəb sahibi olmaq, böyük vəzifəyə çatmaq.

4. Hal, vəziyyət. *Bu məqamda Ədhəmin hər bir xahişinə əməl etmək Nailə üçün əbədi bir səadət, bir ürək rahatlığı idi.* Mir Cəlal.

5. *kit. rəs.* Bir-birinə tabe olan idarə orqanları sistemində müəyyən pillə təşkil edən inzibati və ya başqa idarə. *Ali məqamlara müraciət etmək.*

6. *klas.* b a x **muğam** 1-ci mənada. *Rast məqamı.*

**MƏQBƏR** *is.* [*ər.*] Qəbir, məzar.

**MƏQBƏRƏ** *is.* [*ər.*] 1. Qəbirlərin üzərində xüsusi tikili; türbə, mavzoley. *Nizami məqbərəsi. – Böyük şair taxt-rəvandan düşüb, birbaş Azərbaycan şairi Xaqaninin məqbərəsinə gəldi.* M.S.Ordubadi. *Dünyada sənətin yeddi ecazından biri olan Tac Mahal məqbərəsi də buradadır.* M.İbrahimov.

2. Məzarlıq, qəbiristan. *Baxmadı oğrusu gedər nərəyə; Özü ancaq yüyürdü məqbərəyə.* M.Ə.Sabir. *Şairin əmrinə görə onun taxtrəvanını sürənlər birbaş Surxab məhəlləsindəki şairlər məqbərəsinə tərəf gedirdilər.* M.S.Ordubadi.

**MƏQBUL** *sif.* [*ər.*] 1. Qəbul olunan, bəyənilən, xoşagələn, yaxşı. [Ağa Kərim:] *Özün bilmirsən, sir-sifətin çəndan məqbul deyil!* M.F.Axundzadə. [Xəyyam:] *Minlərcə şəhər ya qala almaqdan, əmin ol; Bir sadə çoban könlünü almaq daha məqbul.* H.Cavid. □ **Məqbul bilmək (görmək)** – daha münasib və əlverişli bilib qəbul etmək; bəyənmək, xoşlamaq. *Düşmən bu tədbiri, deyəsən, daha məqbul bilmişdi*. Ə.Əbülhəsən. **Məqbul etmək** – qəbul etmək, bəyənmək, yaxşı hesab etmək. *Əgər istəsəydi Allah, ki səni edəydi məqbul; Bizə verdiyi tək əlbət sənə həm verərdi pul-mul.* M.Ə.Sabir. **Məqbul olmaq** – qəbul olunmaq, qəbula keçmək, bəyənilmək, xoşlanmaq. [Molla İbrahimxəlil:] *Həmi sənin təvəssütün həmməzhəblərin barəsində məqbul oldu, həm mənim sözüm pozulmadı.* M.F.Axundzadə. *Təqsim eylə, olaq yeməyə məşğul! Amma ki, təqsimin olsun həm məqbul.* Q.Zakir.

2. Şagirdin, tələbənin biliyinə verilən kafi qiymət. *Fizikadan* “*məqbul*” *almaq.*

**MƏQSƏD** *is.* [*ər.*] Əldə edilməyə, nail olmağa çalışılan, qəsd olunan şey; məram, niyyət, arzu. *Məqsədə nail olmaq. – Qaldırdı əşk dün məni ol asitanədən; Kim, məqsədim mənim dəxi ol asitanədir.* Füzuli. *Beləliklə, Naşad əfəndi öz məqsəd və məramına nail olmuş, Zeynal bir fakt olaraq Mehribanı boşamışdı.* S.Hüseyn. □ **Məqsədə (...məqsədinə) düşmək** – arzu etmək, ...niyyətində olmaq. *Əlifba qəbul etmək məqsədinə düşmüş millət latın sistemini qoyub heç vədə ərəb sisteminə raqib olmaz.* F.Ağazadə. **Məqsədə (məqsədinə) yetmək (yetişmək, çatmaq)** – arzusuna nail olmaq, istədiyinə çatmaq, arzusu həyata keçmək. [Nigar:] *Sərdar ölsə aləm yatar; Müxənnət məqsədə çatar.* “Koroğlu”. *Cuma məqsədə yetişmək ümidinin artdığını duyub düşündükcə daha çox qorxmağa başlayırdı.* Ə.Əbülhəsən.

**MƏQSƏDƏUYĞUN** *sif.* Məqsədə müvafiq olan, cavab verən; niyyətə, arzuya düz gələn; münasib. *Ən məqsədəuyğun üsullar.*

**MƏQSƏDƏUYĞUNLUQ** *is.* Məqsədəuyğun olma, qarşıya qoyulan məqsədlə düz gəlmə; münasiblik.

**MƏQSƏDLİ** *sif.* Müəyyən məqsəd güdən, müəyyən məqsədlə edilən, müəyyən məqsəd daşıyan. *Məqsədli səfər.*

**MƏQSƏDSİZ** *sif.* Heç bir məqsəd güdməyən; məqsədlə edilməyən; boş, faydasız. *Məqsədsiz gəzinti. Məqsədsiz həyat.* // Zərf mənasında. *İmran kişi məqsədsiz kimi verdiyi bu suallara cavab gözləmədən səssizcə ayağa qalxıb, o biri otağa keçdi.* M.Hüseyn.

**MƏQSUD** *is.* [*ər.*] *klas.* İstənilən, arzu edilən şey; məram, niyyət, qəsd. *Məqsudun nədir? – Şikəstə könlümün məqsudu, usta! Bu Təbrizin sonaları necədi?* “Abbas və Gülgəz”.

**MƏQTƏ** *is.* [*ər.*] 1. Şeirdə pauza, şeir oxuyarkən durulan yer.

2. *ədəb*. Qəzəlin son beyti (*mətlə* müqabili).

**MƏQTUL** *sif.* [*ər.*] *köhn.* Öldürülmüş, qətl olunmuş. □ **Məqtul olmaq** – qətl edilmək, qətl olunmaq, öldürülmək (silahla). *Sərhəddə vaqe olan son müharibədə Xivə xanı məğlub və məqtul olmuş, başı isə Tehrana gətirilmişdir*. C.Cabbarlı. // *İs. mənasında.* Öldürülmüş, qətl olunmuş adam. *Xülasə, məqtulların arasında* [Yusif şahın] *nəşi görünmədi.* M.F.Axundzadə. *Sonra haman qatil gəlib, məqtulun evinə girəndə onun təqsirindən keçirlər.* Ə.Haqverdiyev.

**MƏQUL** *sif.* [*ər.*] *köhn.* Ağıllı, ağlabatan, ağlauyğun. *Məqul söz.*

**MƏLAHƏT** *is.* [*ər.*] Gözəllik, şirinlik, lətafət; cazibə, duzluluq. *Xanəndənin səsində məlahət var. – Ortaboylu kəndli qızı məlahətdən məhrum deyil idi.* Çəmənzəminli. *Qızarmış yanaqları, uzun kirpikləri, iri gözlərinin süzgün baxışı* [qadına] *məlahət verirdi.* T.Ş.Simurq.

**MƏLAHƏTLİ** *sif.* Gözəl, lətafətli, şirin, xoş; cazibədar, duzlu. *Məlahətli qız. Məlahətli gülüş*. – [Camaat:] *Hacı Ağa, bu qız kim ola, nə məlahətli səsi var?* Mir Cəlal. *Gözəlim, gözlərinin söhbəti hər yanda olur; Bu məlahətli baxışlar quzu, ceyranda olur.* Ə.Vahid.

**MƏLAHƏTLİLİK** *is.* Məlahətli olma.

**MƏLAİK(Ə)** *is.* [*ər.* "mələk" söz. cəmi, Azər. dilində ən çox tək kimi işlənir] Mələk. [Molla deyir:] *Balam, mən indiyə kimi saqqalımda bir dəfə də olsun məlaikə görməmişəm.* "M.N.lətif." // Gözəllik simvolu kimi. *Mina bir pəri, bir məlaikə kimi görünürdü.* İ.Musabəyov.

**MƏLAL** *is.* [*ər.*] Ürək sıxıntısı; usanma, bıqma. // Hüzn, kədər, qəm. *Sizdən soran olsa, ata, halım; Keyfiyyəti-möhnətü məlalım.* Füzuli. *Nədir üzündəki ağlayan kölgə? Bir pəri eşqinin məlalımıdır?* Ə.Cavad. *Adam var yanında olsan bir kərə; Tamam unudular dərdin, məlalın.* B.Vahabzadə.

**MƏLALƏT** b a x **məlal**. *Sənin həsrətini vilayət çəkər; Qəmzən yayı dəyər, məlalət çəkər.* M.P.Vaqif.

**MƏLALLI** *sif.* Qəmli, kədərli, həzin. *Xeyir, o saf qəlbli, məhzun xəyallı; Aşığım bu saat qəmli, məlallı.* M.Müşfiq.

**MƏLAMƏT** *is.* [*ər.*] Danlaq, danlama, məzəmmət, töhmət. *Ey Füzuli, mən məlamət gövhərinin gənciyəm; Əjdəhadır kim, yatıb çevrəmdə zənciri-cünun.* Füzuli. □ **Məlamət etmək (eləmək, qılmaq)** – məzəmmət etmək, danlamaq, töhmətləndirmək. [Mirzə Rəhim ağa:] *Neçə dəfə də çağırıb, məzəmmət, məlamət eləmişəm*. M.S.Ordubadi.

**MƏLEYKƏ** 1. B a x **məlaikə**. [Niyaz:] *Amma sənin arvadın bir candır ki, məleykə xasiyyətində.* Ə.Haqverdiyev.

2. B a x **mələkə**.

**MƏLƏ** *is.* 1. *zool.* Çox bərk sancan qanadsız, zəhərli bir cücü.

2. *məh*. Taxtabiti.

**MƏLƏFƏ** *is.* [*ər.*] Döşəkağı. *Bəy mələfəni götürüb, çarşab kimi saldı başına*. C.Məmmədquluzadə.

**MƏLƏFƏLİ** *sif.* Mələfə salınmış, üzərinə mələfə çəkilmiş; döşəkağılı.

**MƏLƏK** *is.* [*ər.*] 1. Dinə görə, Allahın göstəriş və əmrlərini yerinə yetirən, çox gözəl qadın surətində qeyri-maddi qanadlı bir məxluq; məlaikə. *Mədhin oxur göy üzündə mələklər; Hər biri bir türfə nidayə düşər.* M.V.Vidadi. *Cənnətin hurisi, ərzin mələki; Yetişməz yüz çala əl-ayaq sənə.* Q.Zakir. *Ümid bağlamadın göydə mələkə; Dedin ki, yer qızı ondan gözəldir!* S.Vurğun.

2. *məc.* Çox gözəl və ya məsum, xoşxasiyyət adam haqqında. *Çöllər, təpələr doldu; Şən üzlü mələklərlə.* A.Şaiq. // **Mələkim** şəklində – nəvazişlə müraciət. [Turxan bəy:] *Canın nə istərsə, qəlbindən nə keçirsə, bir an içində mühəyya olur, mələkim!* H.Cavid. [Rüstəm:] *Gözəl mələkim! Mən də fərağında məcnunam.* C.Cabbarlı.

**MƏLƏKÇÖHRƏ(Lİ)** b a x **mələküzlü**.

**MƏLƏKƏ** *is.* [*ər.* məlikə] Padşah arvadı; şahbanu. *O, neçə gündür ki, mələkənin dışarı çıxmasını gözləyirmiş.* M.S.Ordubadi. *Şah .. həyətə çıxdığı zaman mələkə öz əli ilə onu Quran altından keçirib dalınca dua oxumuşdu.* P.Makulu. // Qadın padşah, qadın hökmdar; kraliça.

**MƏLƏKMƏNZƏR** *is.* [*ər.*] Xalq şerində, folklorda gözəlin epitetlərindən biri. *Bərabərin yoxdur huri pəridə; Tək düşübsən mələkmənzər içində.* Q.Zakir. *Zərbilə danışma, ay mələkmənzər; Adətdir nur alar şəmsdən qəmər.* Şair Vəli.

**MƏLƏKMİSAL** *is.* [*ər.*] *klas.* b a x **mələkmənzər**. *Məktəbdə onunla oldu həmdəm; Bir neçə mələkmisal qız həm.* Füzuli.

**MƏLƏKSİMA(LI)** b a x **mələküzlü**. *Ey huriliqalım, mələksimalım; Gözəllikdə olmaz kimsə sən kimi!* M.P.Vaqif. *O mələksimalım, şahbazbaxışlım; O dodağı ballım, ceyran yerişlim*. S.Vurğun.

**MƏLƏKSURƏT(Lİ)** b a x **mələküzlü**.

**MƏLƏKUT** *is.* [*ər.*] Dini təsəvvürə görə, mələklərin və ruhların olduğu yer.

**MƏLƏKÜLMÖVT** *is.* [*ər.* ölüm mələki] 1. Əzrail. *Mən öləndə gördüm, mələkülmövt gəldi.* Ə.Haqverdiyev.

2. *məc.* Çox kifir, bədheybət adam (ən çox qadın) haqqında. *Axtarsan, yoxdur cibimdə dinar; Qızım mələkülmövt, oğlum nahəmvar.* Q.Zakir.

**MƏLƏKÜZLÜ** *sif. şair.* Üzü mələkə oxşayan, mələk kimi gözəl (gözəlin epitetlərindən biri). [Orxan:] *Ah, gözəl çərkəz qızı, nazlı İsmət! Mələküzlü şeytan, incəbel afət!* H.Cavid.

**MƏLƏKZADƏ** *is.* [*ər.* mələk və *fars.* ...zadə] Folklorda, xalq şerində gözəlin epitetlərindən biri. *Görməmişəm sən tək bir mələkzadə; Dərdini çəkərəm həddən ziyadə.* M.P.Vaqif. *Uca boylu mələkzadə; Camalından içdim badə.* Aşıq Ələsgər.

**MƏLƏLƏMƏ** "Mələləmək"dən *f.is.*

**MƏLƏLƏMƏK** *f.* Doğmaq vaxtı yaxınlaşanda döşə (yelinə) süd gəlmək.

**MƏLƏMƏ** "Mələmək"dən *f.is. Bu halda Qızıl inəyin mələməsi Qızxanımın qulağına çatdı.* S.S.Axundov.

**MƏLƏMƏK** *f.* 1. Çığırmaq, bağırmaq, səs çıxarmaq (qoyun-quzu, keçi, maral, inək və s. haqqında). *Keçi mələdi. Maral mələyir. – ..Bir yanda quzular mələyir, bir yanda qıçları bağlı cücə-toyuqlar bağırırdılar.* C.Məmmədquluzadə. *Ceyran oylağında gəzinib mələr; O səsi əks edər uzun dərələr.* S.Vurğun.

2. Sızıltılı səs çıxarmaq, ağlamaq, sızıldamaq, inildəmək. [Bəbir bəy:] "*Yar, yar*" *deyib ömür boyu mələyənlər bəs havayıdırmı?* Mir Cəlal.

3. *məc.* Səs çıxarmaq, səsi eşidilmək. *Birdən zəhərli ilan kimi mələyərək gələn mərmi lap müşahidə məntəqəsini ağzına aldı.* Mir Cəlal. *Qarazurna çay aşağı və çay yuxarı mələyirdi.* Ə.Vəliyev.

◊ **İlan(lar) mələyir** – çox isti, susuz, ilan çox olan çöl (yer) haqqında. *Keçmişdə Muğan düzündə ilan*(*lar*) *mələyirdi.*

**MƏLƏR** 1. *sif.* Ağlar, gözüyaşlı, ağlayan, gözü yaşla dolu.

2. *is. dan.* Ev heyvanı. *Qapıda mələri yoxdur. – Yan çevirsə talar Rumun elini; Qoymaz ölkələrdə mələr Koroğlu.* "Koroğlu".

◊ **Anası mələr qalmaq** – b a x **ana**. [Qumru:] *Kim deyərdi ki, Bəndalı kimi oğulu atacaqlar. Anası mələr qalıb.* Mir Cəlal. **Anasını mələr qoymaq** – b a x **ana**.

**MƏLƏRTİ** *is.* 1. Mələmə səsi. *Qoyun mələrtisi. – ..Qoyun-quzunun mələrtisi dağda-daşda əks-səda verirdi.* B.Bayramov.

2. B a x **mələr** 2-ci mənada. *Ömründə bunların qapısı nə mələrti, nə də xırmanları qılçıq tanıyar.* S.Rəhimov.

**MƏLƏS** *sif.* Turşaşirin, meyxoş, şirintəhər, turşməzə. *Mələs nar.*

**MƏLƏŞMƏ** "Mələşmək"dən *f.is. Qoyun mələşməsi, çoban tütəyi; Çəkir uzaqlara xəyalı, yaylaq.* Aşıq Ələsgər. *Quzuları qoyunlara qatmışdılar. Bir mələşmə vardı ki, gəl görəsən.* R.Rza.

**MƏLƏŞMƏK** *qarş.* 1. Hamı bir yerdə mələmək, səs-səsə verib mələmək. *Qoyun-quzu mələşir. – Mələşmir sürülər, kişnəmir atlar; Niyə pərişandır halların, dağlar!* Aşıq Ələsgər. *Ürgələr oynaşır, atlar güləşir; Qoyunlar səs-səsə verib mələşir.* S.Vurğun.

2. *məc.* Birlikdə ağlamaq, ağlaşmaq, ağız-ağıza verib ağlamaq. *Qadınlar mələşirlər. – ..Kərbəlayı Fərəcin evində uşaqları çörəkdən ötrü mələşirdilər.* Çəmənzəminli.

3. *məc.* Fəryad etmək, ağlaşmaq, ağlamaq. *Min il su-su deyib mələşən çöllər; İndi öz donunu lalədən biçər.* S.Vurğun. *Eşqinə dəm tutub göylər mələşsin; Eşqin tarix olub əbədiləşsin.* B.Vahabzadə.

◊ **İlanlar mələşən** – susuz, çılpaq. *Adamlarımızın zəhmət və iradəsi ilə ilanlar mələşən düzlərdə kanallar çəkildi.*

**MƏLƏTMƏ** "Mələtmək"dən *f.is.*

**MƏLƏTMƏK** *icb.* Mələməsinə səbəb olmaq, ağlatmaq, sızıldatmaq. *Uşağı mələtmək.*

**MƏLƏZ** *sif.* [*ər.* mələs] 1. Müxtəlif irqdən törəmiş; metis. *Mələz adam.*

2. Başqa-başqa cinslərin birləşməsindən törəmiş, qarışıq olan; hibrid. *Mələz qoyun. Mələz arı.* // İs. mənasında. *Mələzlər daha yaxşı kökəlir. – Cıdır sınağından keçmiş 1-ci nəsil ərəb – Qarabağ mələzləri üç yaşında daha yaxşı inkişaf edir.* "Qarabağ atı".

**MƏLƏZLƏŞDİRİLMƏ** "Mələzləşdirilmək"dən *f.is.*

**MƏLƏZLƏŞDİRİLMƏK** *məch.* Cinsləri yaxşılaşdırmaq üçün cütləşdirilmək; hibridləşdirilmək (bitki və heyvanlar haqqında).

**MƏLƏZLƏŞDİRMƏ** "Mələzləşdirmək"-dən *f.is. Azərbaycan camışlarını başqa camış cinsləri ilə mələzləşdirmə yolu ilə təkmilləş-*

*dirmək də vacib məsələlərdən biridir.* A.Ağaoğlu.

**MƏLƏZLƏŞDİRMƏK** *f.* Keyfiyyətcə daha yaxşı növlər və cinslər almaq məqsədilə müxtəlif heyvan və bitki cinslərini cütləşdirmək; hibridləşdirmək.

**MƏLHƏM** *is.* [*ər.* mərhəm] 1. Yaraya və ya ağrıyan yerlərə sürtülən yağlı dərman. *Yaraya məlhəm yaxmaq. – Hələ qədim Misirdə məlhəmlər, həblər, xardal yaxmaları işlədirdilər.* R.Əliyev. *Ağacdan sirkə, efir yağları, kafur yağı, rənglər, laklar və cürbəcür məlhəmlər hazırlanır.* (Qəzetlərdən).

2. *məc.* Dərman, əlac, çarə, şəfa. *Könüldə zəxmi-nihan olmasaydı, ey Seyyid; Ümidi-məlhəm ilə mən fəqanə gəlməz idim.* S.Ə.Şirvani. // *məc.* Təsəlli olacaq, təskin edəcək şey. *Sən də əsirgəmə kömək əlini; Hər sözün, söhbətin can məlhəmidir.* S.Vurğun.

**MƏLİH** *sif.* [*ər.*] Məlahətli, gözəşirin, xoşagələn, şirin, duzlu. *Rozanın məlih ahəngi Firuzun ruhunu, hissini oxşarkən o fikirləşirdi.* H.Nəzərli.

**MƏLİK** *is.* [*ər.*] Hökmdar, padşah.

**MƏLİKƏ** bax **mələkə**. [2-ci cariyə:] *Nazlı məlikəmiz Südabə, əfsus; Hər sevincə qarşı kədərli, məyus.* H.Cavid.

**MƏLİKLİK** *is.* Hökmdarlıq, şahlıq, padşahlıq.

**MƏLİKÜŞŞÜƏRA** *is.* [*ər.*] *tar.* Keçmişdə: hökmdar tərəfindən ən görkəmli saray şairinə verilən fəxri ad; şairlər başçısı.

**MƏLKƏMUT** "Mələkülmövt" sözünün danışıqda işlənən forması. *Məlkəmutun biridir.*

**MƏLUL** *sif.* və *zərf* [*ər.*] Məlallı, qəmgin, məyus, məhzun; bezgin, usanmış. *Məlul görkəm. – Bülbül, neçin, xəzani-sitəmindən məlulsən? Gəl baxgilən, bənim gözüm ilə baharı gör.* Qövsi. [Yaşlı kişi] *hər zaman məlul və qəmgin gəzib təkbaşına dolanır*(*dı*). S.Hüseyn. *Hər daşı bir çılpaq qərib öksüzü; Məlul çöhrəli bir dulu andırır.* M.Müşfiq. ◻ **Məlul etmək** – usandırmaq, bezikdirmək, məyus etmək. *İstəmədim verim dəxi nəzmi-tul; Tulikəlam elər məclisi məlul.* Q.Zakir. **Məlul olmaq** – təngə gəlmək, usanmaq, bezikmək, məyus olmaq.

**məlul-məlul** *zərf* Qəmgin-qəmgin, həzin-həzin, məyus-məyus, yazıq-yazıq. *Yetimlər məlul-məlul Aslanın əlinə baxdılar.* C.Cabbarlı. *Kiminin göz yaşı süzülüb axır; Kimi məlul-məlul dinmədən baxır.* M.Rahim.

**MƏLULCASINA** bax **məlul-məlul**. *Məlulcasına baxmaq.*

**MƏLULLUQ** *is.* Hüzn, kədər, məyusluq; üzgünlük. [Bəhram:] *Ax,* [Saranın] *o ahu baxışlarında nə qədər məlulluq!* C.Cabbarlı.

**MƏLUM** *sif.* [*ər.*] 1. Bilinən, bilinmiş; bəlli, aydın, aşkar, hamıya bəlli olan (*məchul* əksi). *Məlum şey. Məlum məsələ. – Bunların biri cüzamlı Abbas idi, qalanının qaranlıqda kim olduqları məlum deyil idi.* Çəmənzəminli. *Quşun gözəlliyini təsvir etməyə nə mövcud rənglər, nə məlum kəlmələr kifayət edər..* M.Rzaquluzadə. ◻ **Məlum etmək (eləmək)** – 1) görünmək, bəlli olmaq, aydın olmaq. [Gülbadamın] *uşaqlıqda çiçək mərəzinə mübtəla olmağı üzündən məlum edirdi.* N.Nərimanov; 2) xəbər vermək, bildirmək. *..Xəstəxana üçün dörd otaq aranır, hər kəsin böylə bir evi var isə, filan yerə məlum eləsin.* İ.Musabəyov. *Gecə ilə azançıları qalaya çıxarıb, minacat vasitəsilə sabah bayram olduğunu məlum edərdilər.* H.Sarabski. **Məlum olmaq** – bilinmək, aydın olmaq, aydınlaşmaq. *Kəndçilər etdilər dübarə hücum; Yenə oldu yalanlığı məlum.* M.Ə.Sabir. [Xalası:] *Bahar ali məktəbi bitirər, .. sonra hər şey məlum olar.* B.Bayramov.

2. *riyaz.* Məlum olan, verilmiş (*məchul* əksi). *Məlum ədəd. Məlumdan məchula.*

◊ **Məlum feil** *qram.* – hərəkətin həqiqi icraçısının (subyektin) zahirdə olduğu feil növü.

**MƏLUMAT** *is.* [*ər.* "məlum" söz. cəmi] 1. Bir şey haqqında bilik, xəbərdarlıq. [Ənisə] *özünü bilik və məlumatca heç kəsdən aşağı tutmayırdı.* S.Hüseyn. *Həcər qarının çox geniş məlumatı və zəngin təcrübəsi var idi.* Ə.Sadıq.

2. Bir şey haqqında şifahi və ya yazılı arayış, bildiriş, izahat. *Şahmar heç bir söz demədən, yazdığı məlumatı stolun üstünə qoyub qapıdan çıxdı.* B.Bayramov. ◻ **Məlumat vermək** – hər hansı bir iş, hadisə və s. haqqında şifahi və ya yazılı arayış vermək, bildirmək, xəbərdar etmək. *İşin gedişi haqqında məlumat vermək. – Rüstəm kişi yanakı*

*oturub balaca stola dirsəkləndi və yaz əkininə hazırlıq haqqında məlumat verdi.* M.İbrahimov. *Bayram kişi məlumat verməkdə ikən qapı açıldı.* M.Rzaquluzadə.

3. Xəbər, xəbərdarlıq. *Bu barədə məlumatım yoxdur. – Cavad əsirlərdən bir-iki məlumat öyrəndikdən sonra, onları ştaba göndərib yenə ehtiyatla yoluna davam etməyə başladı.* Ə.Vəliyev. ☐ **Məlumat vermək** – xəbər vermək, bildirmək. *Bu barədə yoldaşlara məlumat verin. – Hətta casusa məlumat verənləri yaxşıca axtarmağı da məhkəmənin yadına salacağam*. H.Nəzərli.

**MƏLUMATFÜRUŞ** *is.* [*ər.* məlumat *fars.* ...füruş] Özünü hərtərəfli bilikli göstərməyə, öz biliyini nümayiş etdirərək, başqalarına ağıl öyrətməyə çalışan adam.

**MƏLUMATFÜRUŞLUQ** *is.* Məlumatfüruşun təfəkkür tərzi.

**MƏLUMATLI** *sif.* 1. Məlumatı olan; çox şey bilən, geniş dünyagörüşünə malik olan; bilikli. *Məlumatlı adam*. – *Qadının qarşısında gözəl, yaraşıqlı, ədəbli, məlumatlı və mədəni bir gənc oturmuşdu*. M.S.Ordubadi.

2. Xəbəri olan, xəbərdar. *Məlumatlı dairələr.*

**MƏLUMATSIZ** *sif.* 1. Məlumatı olmayan, dünyagörüşü dar olan; biliksiz. *Məlumatsız adam.*

2. Xəbəri olmayan, bixəbər, xəbərsiz.

**MƏLUMLUQ** *is.* Aydınlıq, aşkarlıq, məlum olma.

**MƏLUN** *sif.* və *is.* [*ər.*] Əsil mənası “lənətə gəlmiş”, “lənətlənmiş”, “Allahın rəhmətindən məhrum”, “mürtəd” olub, Azərbaycan dilində söyüş, qarğış mənasında işlənir. [Nəcəf bəy:] *Bu da Aslan bəy, mənim əziz dostum, məlunlar, müftəxor məlunlar!* Ə.Haqverdiyev. *O məlun kəbin verməmək üçün bu kağızı bizdən oğurlatdırmışdır.* M.S.Ordubadi. [Eldar:] *Bu məlun, yazıq quşların qənimidir.* M.Rzaquluzadə.

**MƏMANİƏT** *is.* [*ər.* mümaniət] Maneçilik, əngəl, maneə. *Təlim ilinin başlanmasını böyük iztirab içində gözləyir, qarşıda olan məmaniətləri rədd etmək üçün vasitələr arayırdıq*. T.Ş.Simurq. *İndi artıq məmaniətə rast gəlmədən batareyanın sol cinahında toplaşmaq üçün dərə yuxarı qaçan düşməni arxadan biçməli idi*. Ə.Əbülhəsən. ☐ **Məmaniət göstərmək (törətmək)** – maneçilik göstərmək, mane olmaq, əngəl törətmək. *Gəlin bəydən hədiyyəni alar. Daha üzünün açılmağına məmaniət göstərməz.* R.Əfəndiyev.

**MƏMANİƏTLİ** *sif.* və *zərf* Məmaniəti olan, maneəli, əngəlli.

**MƏMANİƏTSİZ** *sif.* və *zərf* Məmaniət olmadan, heç bir maneəyə rast gəlmədən, maneəsiz, sərbəst, azad, əngəlsiz. [Mirzə Həsən:] *Şura qoşunu məmaniətsiz Bakıya girə biləcək.* Ə.Haqverdiyev.

**MƏMAT** *is.* [*ər.*] Ölüm, vəfat. *Bəhrifənadə fani ol, gör ki, nə xoş həyat olur; Abihəyatmış fəna, gərçi adı məmat olur.* Nəsimi. *Həvəs sövq eylər insanı həyatə; Ətalət cəlb edər şəxsi məmatə.* M.Ə.Sabir. ☐ **Həyat və məmat məsələsi** – ölüm-dirim məsələsi. *Əjdəri .. evinə gətirib müalicə etmək Mirzə Hüseyn üçün bu saat həyat və məmat məsələsi idi.* S.Rəhman.

**MƏMƏ¹** *is.* 1. Uşaqları əmizdirmək üçün qadınların döş hissəsində yerləşmiş yumru şəkildə olan iki süd vəzilərindən hər biri; döş. // Məməli heyvanlarda süd ifraz edən orqan; yelin.

2. B a x **məməcik** 2-ci mənada. *Gözün məməsi.*

3. *xüs*. Hər hansı bir şeyin məmə ucu (kiçik çıxıntı) şəklində hissəsi; ucluq.

**MƏMƏ²** *is. məc.* Ana. [Şərəfnisə xanım:] *Əgər məməm deyən dərviş olmasaydı, şəksiz Müsyö Jordan Şahbazı aparacaqdı*. M.F.Axundzadə. [Məmməd bacısı Fatmaya:] *..Niyə nənəm Məlikməmmədin nağılını söyləyəndə .. məmənin qucağına qısılırsan?* S.S.Axundov.

**MƏMƏ³** *dan.* Köhnə sistemli ov tüfənglərinin piston qoyulan yeri.

**MƏMƏCİK** *is.* 1. Balaca məmə, kiçik məmə. *Quzunun məməciyi.*

2. *anat.* Görmə sinirinin göz almasına daxil olduğu yer.

3. *anat.* Dərinin üstündə selikli qişada həssas çıxıntı.

**MƏMƏCİKLİ** *sif.* Məməciyi olan, çıxıntılı (b a x **məməcik** 3-cü mənada).

**MƏMƏÇİ** *is. məh.* Südü olmayan qadınların uşağını əmizdirib saxlayan qadın; dayə.

**MƏMƏLİ** *sif.* Məməsi olan. ☐ **Məməli heyvanlar** – bax **məməlilər**. *Soyuq ölkələrdə yaşayan məməli heyvanların dərilərindəki tük həm sıx, həm də çox olur*. M.Axundov.

**MƏMƏLİLƏR** *cəm, zool.* Balalarını öz südü ilə bəsləyən ali onurğalı heyvanlar sinfinin adı. *İlk məməlilər sürünənlərdən əmələ gəlmişdir.* "Ümumi zootexniya".

**MƏMƏŞ** *is. uş.* Məmə.

**MƏMƏYEYƏN** *is.*: **məməyeyəndən-pəpəyeyənə qədər (kimi)** – böyüklü-kiçikli, hamı, hamısı (adamlar haqqında). *Əhalidə olan bu sevinc məməyeyəndən-pəpəyeyənə kimi hamının ürəyindən axıb gəlirdi*. Ə.Vəliyev. [Nisə xanım:] *Məməyeyəndən-pəpəyeyənə qədər, qırılmışlar, hamısı yığılıb.* Ə.Məmmədxanlı.

**MƏMLƏKƏT** *is.* [*ər.*] Bir xalqın yaşadığı yer, ərazi; diyar; ölkə. *Siz bilirsiniz ki, bizim məmləkətin əhalisi qədim zaman atəşpərəst idi.* Ə.Haqverdiyev. *Bundan təkcə bir adama zərər dəymir, bu boyda məmləkətin işi axsayır.* M.Hüseyn.

**MƏMLUK** *is.* [*ər.*] *tar.* 1. Vaxtilə Misirdə olmuş hərbi zadəgan silki və bu silkə mənsub şəxs (bu silk ibtidada Türkiyə sultanlarının şəxsi qvardiyasını təşkil etmiş çərkəz qullardan əmələ gəlmişdi).

2. Napoleon Bonapartın Misir səfəri zamanı təşkil etdiyi şəxsi mühafizə qvardiyası əsgəri.

**MƏMNU** *is.* [*ər.*] Qadağan, qadağan edilmiş, yasaq.

**MƏMNUN** *sif.* [*ər.*] 1. Razı olan, razı, xoşnud. *Neyləmişsən Molla Səfi, Bəybaba; Məmnundu, əzizim, bu qədər səndən.* Q.Zakir. [Kor Seyid] *Məsmənin bu təşəbbüsündən məmnun deyilmiş.* S.Hüseyn. // *Zərf mənasında.* Razı, xoşhal; sevincək. *Məmnun qayıtmaq*. ☐ **Məmnun etmək** – sevindirmək, şad eləmək, razı salmaq, razı etmək. [Xanımın] *gülər üzü studenti çox məmnun etdi.* Çəmənzəminli. **Məmnun qalmaq** – razı qalmaq, xoşhal olmaq. *Səyahətçilər müəssisə müdirinin verdiyi ziyafətdən məmnun qaldılar.* M.S.Ordubadi. *Sənin məmnun olduğun gün; Ruhum məndən məmnun qalır.* Ə.Cavad. **Məmnun olmaq** – razı düşmək, xoşhal olmaq, sevinmək, şad olmaq. [Şeyda:] *Ah, bilsəniz bu xəbərdən nə qədər məmnun oldum*. H.Cavid.

**MƏMNUNİYYƏT** [*ər.*] 1. Bax **məmnunluq**. [Hacı Qulu] *dodaqlarında məmnuniyyət andıran bir təbəssüm olduğu halda* [dedi]. A.Şaiq. *Xəlilin qanı coşdu, həyatına qarşı olan məmnuniyyətinin həddi yox idi.* Çəmənzəminli.

2. **Məmnuniyyətlə** şəklində *zərf* – xoşluqla, razılıqla; şad olaraq, sevinərək, məmnun halda, məmnunluqla. *Aslan məmnuniyyətlə razı olub, Hacıdan xahiş elədi ki, pulsuz da xidmət etməyə hazırdır*. C.Cabbarlı. *Gülzar məmnuniyyətlə dolu gözlərini Rüstəmə tərəf qaldırıb gülümsədi.* T.Ş.Simurq.

**MƏMNUNLUQ** *is.* 1. Xoşhallıq, razılıq, sevinc. *Məmnunluğunu ifadə etmək.*

2. **Məmnunluqla** şəklində *zərf* – bax **məmnuniyyətlə** ("**məmnuniyyət**"də). *Vahid də bu gün xoş bir xatircəmlik, məmnunluqla evə qayıtdı.* Mir Cəlal.

**MƏMUL** [*ər.*] *sif.* Hazırlanmış, düzəldilmiş. [Cehiz üçün] *iki dəst yorğan-döşək, nazbalış, .. gümüşdən məmul zirəndazlar .. tədarük görüləcəkdir.* R.Əfəndiyev.

**MƏMULAT** *is.* [*ər.* emal olunmuş şeylər] Fabrik və ya başqa vasitələrlə istehsal olunmuş, hazırlanmış şeylər, məhsullar. *Zavodun məmulatı.* // Həmin məhsulun eyni qrupa daxil olan növü. *Saxsı məmulatı. Kulinariya məmulatı.*

**MƏMUR¹** [*ər.*] *köhn.* 1. *is.* Dövlət idarələrində (əsasən, məhkəmə, polis və s.) çalışan qulluqçu; dövlət xidmətçisi, çinovnik. *Hökumət məmuru. – Hər kəs* [Zeynala] *adi bir idarə məmuru kimi baxırmış.* S.Hüseyn. *Qarşımızı polis məmurları saxladı siz bizi məktəbə dönməyə məcbur etdilər*. T.Ş.Simurq.

2. *sif.* Müəyyən bir iş, vəzifə görməyə əmr və ya tapşırıq almış. *Kürsünü çəkməyə məmur olan çar soldatı öz vəzifəsini artıq yerinə yetirmişdi.* M.S.Ordubadi.

**MƏMUR²** *is.* [*ər.*] *klas.* Abad, abadan. *Qoy cahan elm ilə pürnur olsun; Vətən o sayədə məmur olsun.* A.Səhhət. *Qalmadı bərqərar bir xanə; Cümlə məmur oldu viranə*. M.Ə.Sabir. // Əhalisi olan, məskun, şen.

**MƏMURİYYƏT** *is.* [*ər.*] *köhn.* Dövlət xidmətində olma; vəzifə, xidmət, qulluq.

*O zaman mənim məmuriyyətim Ənzəlidə idi.* S.Hüseyn.

**MƏN**[1] Danışan adamı bildirən birinci şəxs əvəzliyinin təki. *Mən sonra gələrəm. Mən deyən oldu. – Ah, mən gündən-günə bu gözəlləşən; İşıqlı dünyadan necə əl çəkim?* M.Müşfiq.

◊ **Mən ölüm** *dan.* – xahiş və ya yalvarış məqamında işlədilir. *Sizə bu təziyədən özgə həvəslərdi murad; Mən ölüm, sən bir özün eylə mürüvvət, Hadi!* S.Ə.Şirvani.

**MƏN**[2] *is.* [*ər.*] *köhn.* Qadağan, yasaq; buraxmama, qoymama, yol verməmə. □ **Mən etmək** – qadağan etmək, qoymamaq, yol verməmək, icazə verməmək, daşındırmaq. *Sahibi-xanə qardaşının sözlərini eşidib, onu bu xatalı səfərdən mən edir.* F.Köçərli. [Mirzə Cəfərxan:] *Söhbət axır bu yerə yetdi ki, Əlixan Əfşar bizim hər bir təklifimizi mən etdi.* Ə.Haqverdiyev. **Mən olmaq** – qadağan edilmək, icazə verilməmək, qoyulmamaq.

**MƏNA** *is.* [*ər.*] 1. Sözün, cümlənin ifadə etdiyi məfhum, anlayış. *Sözün hərfi mənası. Həqiqi məna. Məcazi məna. – Ləfz özü bir ləfzdir, amma ki, məna müxtəlif.* S.Ə.Şirvani. *Sözlərdəki məna səslərdəki titrəyiş isə* [Rüstəmə] *çatmırdı.* M.İbrahimov.

2. Bir şeyin ağılla dərk edilən daxili məntiqi məzmunu, mahiyyəti. *Hadisələrin mənası.* // Məqsəd, ağlabatan səbəb. *Bunu belə etməkdə məna yoxdur. – ..Orucluğun ümdə mənası budur ki, müsəlmanlar ac qalmağa adət eləsinlər.* C.Məmmədquluzadə. □ **Məna vermək** – əhəmiyyət vermək, diqqət yetirmək. *Həmişə kəmetina Zeynal bu gecə hər şeyə diqqətlə baxıb, hər bir hənirtiyə məna verməyə başladı.* Çəmənzəminli.

**MƏNACA** *zərf* Mənaya görə, məna cəhətdən; məzmunca. *Mənaca dərin əsər. Mənaca təhrif olunmuş ifadə.*

**MƏNAFE** *is.* [*ər.* "mənfəət" söz. cəmi] 1. Mənfəət, fayda, nəf, xeyir. *Mənim dediyim budur ki, pul qazanmaqda sairlərinin mənafeyinə əl uzatmayasan.* Ü.Hacıbəyov.

2. Bir kəsin, bir şeyin rifahını təşkil edən, onun xeyrinə olan, ehtiyac və tələblərinə xidmət edən şey. *Sinfi mənafe. Şəxsi mənafeyi cəmiyyətin mənafeyi ilə uzlaşdırmaq.*

**MƏNALANDIRMA** "Mənalandırmaq"dan *f.is.*

**MƏNALANDIRMAQ** *f.* 1. Mənasını açmaq, şərh etmək, izah etmək, məna vermək. *Birinci dəfə idi ki, başına gələn işləri bir tarix, bir ictimai əhəmiyyətli hadisə kimi mənalandırırdı.* Mir Cəlal.

2. Məna vermək, qiymətləndirmək, müəyyən etmək, müəyyənləşdirmək, dərk etmək. *Ətrafında baş verən hadisələri düzgün mənalandırmağa çalışırsan.* H.Seyidbəyli. [Ana] *oğlunun qaradinməz olduğunu özlüyündə mənalandırmışdı.* B.Bayramov.

**MƏNALANMA** "Mənalanmaq"dan *f.is.*

**MƏNALANMAQ** *f.* 1. Məna almaq, müəyyənləşmək, aydınlaşmaq. *Qoşmada sözlər inci kimi seçilmiş, mənalanmış, musiqi parçası kimi bəstələnmişdir.* M.İbrahimov.

2. Məna qazanmaq, əhəmiyyət qazanmaq, əhəmiyyət kəsb etmək. *Ömür mənalanır şirin keçəndə.* M.Rahim.

**MƏNALI** *sif.* 1. Mənası olan, müəyyən mənaya malik. *Həqiqi mənalı söz. Məcazi mənalı söz.*

2. Böyük daxili məzmunu, mənası olan; dolğun, ağıllı. *Mənalı söz. Mənalı həyat. – Dedim: – Qızım, bu sualın; Nə dərindir, nə mənalı?* N.Rəfibəyli.

3. *məc.* Gizli mənası olan, bir şeyə işarə edən; üstüörtülü. *Mənalı bir baxış. Mənalı sual.*

**mənalı-mənalı** *zərf* Bir şey, bir məqsəd ifadə edərək. *Qayınana susur, köksünü mənalı-mənalı ötürür, gözləri yaşarırdı.* Çəmənzəminli. *Ovçu dostum bir söz demədisə də, amma mənalı-mənalı mənə baxdı.* M.Rzaquluzadə.

**mənalı-mənasız** *zərf* Boş-boşuna, yerli-yersiz. *Mənalı-mənasız danışmaq.* – [Eyvaz:] *Qarşıma hər kəs çıxırdısa mənalı-mənasız söhbətə tuturdum.* İ.Əfəndiyev.

**MƏNALILIQ** *is.* Müəyyən mənaya malik olma, məna daşıma, mənalı olma. *Sözün mənalılığı.*

**MƏNASIZ** *sif.* 1. Mənası olmayan, heç bir məna daşımayan. [Cavanlar] *ancaq axırıncı bir-iki mənasız sözü dəyişmədən təkrar edirdilər..* Ə.Əbülhəsən. *Odur ki, mənasızdır, bil, verdiyin bu sual.* Z.Xəlil.

2. Məzmunca əhəmiyyətsiz, məzmunsuz, mənadan məhrum. *Mənasız roman. Mənasız şeir.*

3. *məc.* Əqlə uyuşmayan, yersiz, boş, yaraşmayan; əbəs, bihudə. *Nə deyim böylə bu mənasız işə.* Ə.Cavad. *İnsan olmasaydı hər çay, hər bulaq; Mənasız* (z.) *axardı, barsız, bəhərsiz.* M.Dilbazi.

4. *məc.* Heç bir məna ifadə etməyən; küt. *Mənasız nəzər.*

**MƏNASIZLIQ** *is.* Mənasız bir şeyin hal və keyfiyyəti, bihudəlik, daxili məna və məzmundan məhrumluq. *Fikrin mənasızlığı. – İskəndər "ölülər aləminin" saxtakarlığını, yalanını, puç və mənasızlığını faş edib lənətləyir.* M.İbrahimov.

**MƏNBƏ** *is.* [*ər.*] 1. Yeraltı suların çıxdığı yer; qaynaq, bulaq, çeşmə.

2. *məc.* Əsasını, başlanğıcını təşkil edən şey. *Xammal mənbələri. Gəlir mənbəyi. – Otağın işıq mənbəyi bircə qapı və bir də damdakı şüşələnmiş balaca pəncərəvari bir baca olduğundan, otaq lazımi qədər işıq deyildi.* T.Ş.Simurq. *Axır illər çayqıraqlı arvad-uşaq üçün burada bir qazanc mənbəyi də yaranmışdı.* Ə.Əbülhəsən. // *məc.* Bir xəbərin və s. çıxdığı, zahir olduğu yer. *Xəbərin mənbəyini bilmək. İnanılan mənbələrdən alınan məlumata görə.*

3. B a x **məxəz** 2-ci mənada. *Rus mənbələrinə gəldikdə bunlardan* [bizim] *tarixə aid bir çox mühüm şeyləri ixrac etmək olar.* F.Ağazadə.

4. *coğr.* Çayın başlandığı yer (*mənsəb*[2] əksi). *Kür çayının mənbəyi. Arazın mənbəyi.*

**MƏNBƏŞÜNAS** *is.* [*ər.* mənbə və *fars.* ...şünas] Mənbəşünaslıq mütəxəssisi; məxəzşünas.

**MƏNBƏŞÜNASLIQ** *is.* Tarixi mənbələrin tədqiqi və onlardan istifadə üsullarını işləyib hazırlayan köməkçi fənn, habelə həmin mənbələrin özü; məxəzşünaslıq.

**MƏNCƏ** Mənə görə, mənim fikrimcə, mənim düşündüyümə görə. *Gözəl olur bu yerlərin səhəri; Məncə vardır dünyalara dəyəri.* A.Şaiq. [Nadir bəy:] *Məncə gözəllik zövqə aid bir şeydir.* H.Cavid.

**MƏNCİYƏZ** "Mən"dən *oxş.* [Gülçöhrə:] *Yox, manciyəz görüb bəyənməyincə ərə getməyəcəyəm.* Ü.Hacıbəyov. [Xanımnaz:] *..Mənciyəz şəhərə gedirəm.* C.Cabbarlı. [Həcər:] *Mənciyəz anamdan yeyərdim töhmət.* S.Rüstəm.

**MƏNDƏCƏR** *is.* Əkilməmiş yer, xam torpaq. [Padşahın] *imarətinin dalında bir məndəcər vardı, həmin məndəcərin günçıxan əlində bir dərin quyu qazıyıb, sandığı basdırıb quyuya..* (Nağıl).

**MƏNDƏCƏRLİK** *is.* Məndəcər yer.

**MƏNDİL**[1] *is.* [*ər.*] 1. Cib dəsmalı, yaylıq. *Xətayini görcək xəta eylədim; Ləl, gövhər bir məndilə bükülmüş.* Aşıq Valeh. *Cibindən bir məndil çıxarıb göz yaşlarını silir.* H.Cavid.

2. *məh.* Ləçək.

**MƏNDİL**[2] *is.* Tayanın çürüməməsi üçün altına qoyulan köhnə ot.

**MƏNDULƏ** *is.* Keçmişdə arxalıq, şalvar və s. tikilən nazik və möhkəm parça növü. // Həmin parçadan tikilmiş. *Məndulə çarşab. Məndulə şalvar. – ..Qurşağı yerdən sürünür, məndulə arxalığının yaxası sallanırdı.* Mir Cəlal.

**MƏNƏMLİK** *is.* Təkəbbür, lovğalıq, özünü dartma. [Mədəd:] *Mənəmlik, təkəbbür, heç kəsi bəyənməmək, hamıya alçaq nəzərlə baxmaq – budur sənin ən böyük qüsurların.* Ə.Vəliyev. ◻ **Mənəmlik etmək** – lovğalanmaq, özündən başqa heç kəsi saymamaq.

**MƏNƏM-MƏNƏM: mənəm-mənəm demək** – lovğalanmaq, təkəbbür göstərmək, özündən başqa heç kəsi saymamaq. *Mənəm-mənəm deyənlərin inanma çox da qövlünə.* M.Ə.Sabir. *Vaqif gördü ki, İbrahim xan onun sözlərinin məğzini dərk etmir, mənəm-mənəm deyir, .. dillənmədi.* Çəmənzəminli.

**MƏNƏM-MƏNƏMLİK** b a x **mənəmlik**. [Qoşatxan:] *Öldür səni içəridən gəmirən qurdu – bu mənəm-mənəmlik qurdunu.* M.İbrahimov.

**MƏNƏN** *zərf* [*ər.*] Mənəvi cəhətdən; ruhən. *..Bizim şüəra cismən ölüb fövt olublarsa da, ruhən və mənən həlak olmayıblar.* F.Köçərli.

**MƏNƏNƏ** *is. zool.* Bitkilərin şirəsilə qidalanan ziyanverici bir cücü növü.

**MƏNƏVİ** *sif.* [*ər.*] İnsanın daxili, ruhi aləmi ilə bağlı olan, mənəviyyatla əlaqədar; batini, qeyri-cismani, qeyri-maddi. *İnsanın*

*mənəvi aləmi. Mənəvi tələbat. Mənəvi məsuliyyət. Mənəvi əzab. – Kimsə* [Zeynalı] *sevməyir, müdafiə etməyir, mənəvi və maddi müavinətdə bulunmayırdı.* S.Hüseyn. *Mənəvi bir qüvvə sanki* [Rubabənin] *çiyinlərindən tutub, vücudunu ağac kimi bərk silkələdi.* Mir Cəlal.

**MƏNƏVİYYAT** *is.* [*ər.*] İnsanın mənəvi keyfiyyətləri, normaları; yüksək əxlaq. *Xalqın mənəviyyatı. Yüksək mənəviyyat. – O kəslər ki, müəllimlik kimi .. xidməti tərk edib, qeyri peşə dalısınca gediblər, mənəviyyat cəhətincə öz əhdü-peymanlarını şikəst ediblər..* F.Köçərli.

**MƏNFƏƏT** *is.* [*ər.*] 1. Gəlirin xərci çıxdıqdan sonra qalan artıq hissəsi, pul gəliri; qazanc. *Tacirin mənfəəti.*

2. *dan.* Fayda, xeyir. *Qəzetin çoxdu xalqa mənfəəti.* S.Ə.Şirvani. [Palıd:] *Qış sobada xalq məni yandırar; Mənfəətim xalqa mənim çox dəyər.* M.Ə.Sabir. *Elin zərərindən mənfəət uman; Boyansın, demişəm, al-qana, dağlar!* S.Vurğun.

**MƏNFƏƏTBƏRDAR** *sif.* [*ər.* mənfəət və *fars.* ...bərdar] *köhn.* b a x **mənfəətdar**. □ **Mənfəətbərdar olmaq** – fayda götürmək, mənfəət əldə etmək, faydalanmaq. [Gülbahar:] *Dadaş, o lüğəti ki, sən yazırsan, bu bir yadigardı ki, hər bir kəs oxuyub mənfəətbərdar olacaq.* C.Məmmədquluzadə.

**MƏNFƏƏTDAR** *sif.* [*ər.* mənfəət və *fars.* ...dar] Maddi cəhətdən mənfəəti olan; fayda görən, qazanc götürən, mənfəət əldə edən; mənfəətbərdar.

**MƏNFƏƏTDARLIQ** *is.* Maddi cəhətdən mənfəətdar olma; mənfəət götürmə, qazanc əldə etmə.

**MƏNFƏƏTGÜDƏN** b a x **mənfəətpərəst**.

**MƏNFƏƏTLİ** *sif.* Mənfəət verən, xeyirli, gəlirli, faydalı. *Mənfəətli iş.* – [Yusif Hümmətə:] *Camaat üçün nə mənfəətlidir, nə gəlirlidir – onu əksin.* B.Bayramov.

**MƏNFƏƏTLİLİK** *is.* Mənfəətli olma; xeyirlilik, gəlirlilik, faydalılıq.

**MƏNFƏƏTPƏRƏST** *is.* və *sif.* [*ər.* mənfəət və *fars.* ...pərəst] Şəxsi mənfəətini, öz xeyrini güdən (adam). *Mənfəətpərəst adam.*

**MƏNFƏƏTPƏRƏSTLİK** *is.* Öz mənfəətini, öz xeyrini güdmə.

**MƏNFƏƏTSİZ** *sif.* Heç bir mənfəəti, xeyri, faydası olmayan; xeyirsiz, faydasız. *Mənfəətsiz iş.*

**MƏNFƏƏTSİZLİK** *is.* Mənfəəti olmama; xeyirsizlik, faydasızlıq, qazancsızlıq, gəlirsizlik.

**MƏNFİ** *sif.* [*ər.*] 1. Mənfilik bildirən, inkar bildirən, rədd edən (*müsbət* əksi). *Mənfi cavab.*

2. Gözlənilən nəticənin ziddinə olan, heç bir müsbət nəticə verməyən. *Mənfi nəticə.* // Pis, fəna. *Mənfi rəy. Mənfi tip. Mənfi xasiyyətnamə.* – [Mahmud:] *İki dəfə müayinə nəticəsi mənfi olub, bu dəfə də mənfi olacaq.* Çəmənzəminli. *Məlumdur ki, tənqidi realistlərin əsas diqqəti həyatın mənfi cəhətlərində idi.* M.İbrahimov.

3. *riyaz.* Sıfırdan az. *Mənfi kəmiyyət* (*ədəd*). // Sıfırdan aşağı olan hava temperaturunu göstərmək üçün işlədilir. *Mənfi* ( – ) *3° soyuq.*

4. *fiz.* Elektrikin, hissəcikləri elektronlardan ibarət növünə aid olan. *Mənfi elektrik yükü.*

**MƏNFİLİK** *is.* Mənfi xüsusiyyət, çatışmayan cəhət, pis cəhət; nöqsan, kəsir. [Cəlil Məmmədquluzadənin] *mənfiliklərə, həyatın çürümüş cəhətlərinə qarşı münasibətində də xəlqilik həlledici rol oynayırdı.* M.İbrahimov.

**MƏNFUR** *sif.* [*ər.*] Nifrət olunan, nifrətə layiq, nifrətli, xoşa gəlməyən, çox pis; sevilməyən, istənilməyən. [Humay:] *Cəmili azarlatdığım o mənfur saat, o məşum dəqiqələr kaş ki, yaranmayaydı.* H.Cavid. [Səfərəli:] *Mən sizi düşmənlərin bu mənfur hərəkətinə etiraz etmək üçün tətilə çağırıram.* H.Nəzərli. *..Düşünürdü ki, artıq qorxunu mənfur bir hiss kimi ürəyindən çıxarıb atmalıdır.* S.Rəhman.

**MƏNFURLUQ** *is.* Nifrətə layiq olma, xoşa gəlməmə; iyrənclik.

**MƏNGƏL** *is.* Kol-kosları kəsib doğramaq üçün çapacaq; dəhrə.

**MƏNGƏNƏ** *is.* [əsli *yun.*] 1. Hər cür şeyi sıxıb saxlamaq üçün çilingər aləti. *Dəmirçi mənqənəsi.* // Meyvə və s. sıxıb suyunu çıxarmaq üçün alət, cihaz.

2. *məc.* Sərbəstliyə mane olan, sıxan, təzyiq edən, əziyyət verən şey haqqında. *Ehtiyac məngənəsi. Böhran məngənəsi.* – [Nüşabə:] *Mənə öz həyatım olmuş məngənə.*

A.Şaiq. *Sən düşəndə məngənəyə mənim dərdim bir dağ olar.* M.Rahim. [Səttar xan:] *Bizi sıxan siyasi məngənənin rolu daha mühümdür.* P.Makulu.

3. Çayın məngənədə sıxılmış (preslənmiş) növü. *Çay məhsulunun əsas növləri məxməri və məngənə çaylarıdır.* F.Fətəlizadə.

**MƏNGƏNƏLİ** *sif.* Məngənəsi olan, məngənə qoyulmuş. *Məngənəli çilingər dəzgahı.*

**MƏNGİRLƏMƏ** "Məngirləmək"dən *f.is.*

**MƏNGİRLƏMƏK** *f. dan.* Tez qarmalamaq, ələ keçirmək, mənimsəmək.

**MƏNHUS** *sif.* [*ər.*] Uğursuz, bədbəxt, nəhs. [Mahmud] *bir də əllərini qovzadı, istədi keçmişki həyatından o mənhus dəqiqələri qoparıb atsın.* Çəmənzəminli. [Qönçə:] *Bu mənhus evdən, bu müdhiş zindandan qurtaracağam, – deyirdim.* S.Hüseyn. // Pis, alçaq, rəzil.

**MƏNHUSLUQ** *is.* Uğursuzluq, nəhslik, pislik.

**MƏNİMSƏMƏ** "Mənimsəmək"dən *f.is.*

**MƏNİMSƏMƏK** *f.* 1. Bir işi görüb götürmək, öyrənmək, özünə aşılamaq. [Fərman müəlliminin] *dediklərini mənimsər və rusca hələ zəif bilməsinə baxmayaraq, kəlmələri bir-birinə quraşdıraraq sualı sual dalınca verərdi.* Ə.Sadıq.

2. *məc.* Yaxşı-yaxşı öyrənərək, başa düşərək yadda saxlamaq. *Fizikanı yaxşı mənimsəmək. İş üsulunu mənimsəmək.*

3. *məc.* Qəbul edərək, udaraq həzm etmək. *Xörəyi yaxşı mənimsəmək.*

4. Qanunsuz olaraq başqasının malına, puluna və s. sahiblənmək, yiyələnmək. *Özgənin kitabını mənimsəmək.*

**MƏNİMSƏNMƏ** "Mənimsənmək"dən *f.is.*

**MƏNİMSƏNMƏK** *məch.* Yaxşı-yaxşı öyrənilmək, başa düşülmək, yadda saxlanılmaq.

**MƏNKUHƏ** *is.* və *sif.* [*ər.*] *köhn.* Nikahlı (kəbinli) arvad, qanuni arvad. [Ağa Mərdan:] *Hamı bilir ki, Zeynəb xanım Hacı Qafurun daimi mənkuhəsi deyil, onun dövlətindən irs hesabında hərgiz hissəsi yoxdur*. M.F.Axundzadə. [Mirzə Əhmədağa:] *Sən, qızın mənim özümə mənkuhə olmasına riza ver.* Ə.Haqverdiyev.

**MƏNQUL** *sif.* [*ər.*] *köhn.* 1. Bir yerdən başqa yerə aparılmış.

2. Dillərə düşmüş, ağızdan-ağıza düşmüş.

3. Nəql edilmiş, söyləmiş.

**MƏNLİK** *is.* 1. Bir şəxsin öz varlığı, öz halı. *Məndə dəxi necə mənlik olsun; Məndən məni istəyən nə bulsun?* Füzuli.

2. Öz ləyaqətini dərk etmə, öz şəxsiyyətinin qiymətini bilmə; heysiyyət, şərəf. [Əski həyat] *..Xədicənin mənliyini gəmirmiş, gəncliyini və gözəlliyini əlindən almışdı.* S.Hüseyn. *Aslan isə öz nəfsini saxlayan və mənliyini sevən adam idi.* S.Vəliyev.

**MƏNLİKSİZ** *sif.* Mənliyi olmayan; heysiyyətsiz, şərəfsiz, ləyaqətsiz. *Mənliksiz adam.* – [Fərman] *Mələyin hər şeyə dözdüyünü gördükdə mənliksiz, heysiyyətsiz bir adam olduğunu düşündü.* M.İbrahimov.

**MƏNLİ-SƏNLİ** *zərf* Mən və sən birlikdə, öz aramızda. *Məsələni mənli-sənli həll edək.*

**MƏN-MƏN: mən-mən demək** – bax **mənəm-mənəm demək** ("**mənəm-mənəm**"də). *Mənim mən-mən deməyim sanmayın boş əməkdir.* S.Rüstəm. *Kərəmov öz fərsiz şəxsiyyətini cəmiyyətə qarşı qoyan, hər yerdə mən-mən deyən cahil bir xudpəsənddir.* İ.Əfəndiyev.

**MƏNSƏB**[1] *is.* [*ər.*] Yüksək vəzifə, böyük məqam; ümumiyyətlə, vəzifə. *Kasıbın toyuna seçilmiş, imtiyazlı, mənsəb, sərvət sahibləri çağırılmazdı.* H.Sarabski. [Səməd] *mənsəb nərdivanı ilə yuxarı dırmaşmaqda davam etdi.* B.Talıblı.

**MƏNSƏB**[2] *is.* [*ər.*] *coğr.* Çayın dənizə, gölə və ya başqa çaya töküldüyü yer; ağız, qovşaq (*mənbə* əksi). *Çayın mənsəbi.*

**MƏNSƏBPƏRƏST** [*ər.* mənsəb və *fars.* ...pərəst] bax **vəzifəpərəst**. *Mənsəbpərəst adam.*

**MƏNSƏBPƏRƏSTLİK** bax **vəzifəpərəstlik**.

**MƏNSUB** *sif.* [*ər.*] Nisbəti və mənsubiyyəti olan, əlaqəsi olan, aidiyyəti olan. [Keşikçilərin] *içində yapıncılı ləzgi və qumuq, Cavanşir elinə mənsub sallaqbığlı .. atıcılar var idi*. Çəmənzəminli. *Zeynal öz yaramazlıqlarını doğrultmaq üçün mühitlərini ləkələndirməyə çalışan bir qrup adamlara mənsub idi.* S.Hüseyn. □ **Mənsub olmaq** – bir şəxsə və ya bir şeyə nisbəti olmaq, aid olmaq, aidiyyəti olmaq. [Sədr:] *Müttəhim Baxşının*

*qiyamçılar təşkilatlarına mənsub olması haqqında sizin əlinizdə başqa bir sübut varmı?* C.Cabbarlı. *Maşının üstündə milis idarəsinə mənsub olduğunu bildirən heç bir nişanə yox idi.* H.Seyidbəyli.

**MƏNSUBİYYƏT** *is.* [*ər.*] Mənsub olma, aid olma; aidiyyət, təəllüq.

**MƏNSUR** *sif.* [*ər.*] Nəsrlə yazılmış (*mənzum* əksi). *Ordubadinin mənsur əsərləri.* ☐ **Mənsur şeir** – nəsr şəklində yazılmış kiçik lirik əsər.

**MƏNSURİYYƏ** *is.* [*ər.*] *mus.* Azərbaycan klassik muğamlarından birinin adı. *Mənsuriyyə yeni melodiya bəstələnməsini yox, mayeyi-çargahın bir oktava yuxarı köçürülməsini tələb edir.* Ü.Hacıbəyov.

**MƏNŞƏ** *is. ər.* 1. Bir şeyin çıxdığı, nəşət etdiyi, törədiyi yer. // Meydana gəlmə, zahir olma, əmələ gəlmə; törəmə, nəşət, əsil. *Dilin mənşəyi. Həyatın mənşəyi. Neftin mənşəyi.*

2. Sayca, əsilcə, milliyyətcə, sinifcə və s. cəhətcə mənsubiyyət. *Qaraqoyunluların mənşəyi. Azərbaycanlıların mənşəyi.*

**MƏNŞƏCƏ** *zərf* Mənşəyinə görə, mənşə etibarilə, törənişinə görə. *Mənşəcə azərbaycanlıdır.*

**MƏNŞƏLİ** *sif.* Müəyyən mənşəyi olan, bu və ya başqa mənşəyə mənsub olan, hər hansı bir mənşədən törəyən. *Bitki mənşəli dərman. Hibrid mənşəli heyvan.*

**MƏNTƏQƏ** *is.* [*ər.*] 1. Hər hansı bir məqsəd üçün istifadə olunan müəyyən əlamətlərə malik yer. *Strateji məntəqə. Müşahidə məntəqəsi. Komanda məntəqəsi*. *Məskun məntəqə* (əhali yaşayan hər bir yer – kənd, qəsəbə və s.). // Hər hansı bir iş, əməliyyat və s. üçün uyğunlaşdırılmış bina, yer. *Qəbul məntəqəsi. Alıcı məntəqəsi. – Göyçək .. səhiyyə məntəqəsində işləyir.* Ə.Əbülhəsən. *Seçki məntəqəsi gözəl bəzənmiş; Bir yaraşıq verir bizim məhləyə.* O.Sarıvəlli.

2. B a x **qurşaq** 4-cü mənada.

**MƏNTİQ** *is.* [*ər.*] 1. Təfəkkürün qanun və formaları haqqında elm. *Dialektik məntiq. Formal məntiq.*

2. Fikrin, əqli nəticənin düzgünlüyü, ağlabatanlığı. *Məntiqə zidd fikir. – Şərifzadə Zeynala heç bir haqq vermək istəməyirdi. Onun məntiqindən bir şey başa düşmədiyini söyləyirdi.* S.Hüseyn.

3. Daxili qanunauyğunluq. *Hadisələrin məntiqi.*

**MƏNTİQCƏ** *zərf* Məntiqə, məntiq qanunlarına görə. *Məntiqcə düzdür.*

**MƏNTİQÇİ** b a x **məntiqşünas**.

**MƏNTİQİ** *sif.* [*ər.*] 1. Məntiq qanunlarına uyğun, məntiq qanunlarına əsaslanan. *Məntiqi sübut. Məntiqi ardıcıllıq. – Mirzə Qədir məntiqi cavab verməkdən çəkinər.* S.Hüseyn. // Məntiq qanunlarına əsasən müəyyənləşdirilən, meydana çıxarılan. *Məntiqi ziddiyyət. Məntiqi səhv.*

2. Bir şeyin öz xasiyyətindən, daxili qanunlarından doğan, törəyən, çıxan; zəruri, qanunauyğun. *Məntiqi nəticə. Hadisələr arasında məntiqi əlaqə.*

◊ **Məntiqi vurğu** – cümlədə mənaca əsas sözün yüksələn intonasiya ilə tələffüz edilməsi.

**MƏNTİQİLİK** *is.* Məntiq qanunlarına uyğunluq, məntiq qaydalarına əsaslanma; məntiqlilik. *Nəticələrin məntiqiliyi.*

**MƏNTİQLİ** *sif.* Məntiq qanunlarına uyğun, məntiqi; danışığında məntiq olan. *Məntiqli* (z.) *danışmaq.*

**MƏNTİQLİLİK** *is.* Məntiq qanunlarına uyğun olma; məntiqilik. *Dəlillərin məntiqliliyi.*

**MƏNTİQSİZ** *sif.* və *zərf* Məntiqdən məhrum, məntiqlə düz gəlməyən, məntiqə zidd olan; ziddiyyətli, ardıcıl olmayan. *Məntiqsiz danışıq. – İnsaf dərnəkdə dediklərini bir az məntiqsiz halda anasına izah etdi*. Mir Cəlal. *Meracın danışığının məntiqsiz, mündəricəsiz olacağını düşünən Bəhram indi onun danışığını dinləməyi qət etdi.* Ə.Vəliyev.

**MƏNTİQSİZLİK** *is.* Məntiqdən məhrumluq, məntiqlə uyuşmama, məntiqə zidd olma; qeyri-məntiqilik. *Danışığın məntiqsizliyi. – Sözlərindəki məntiqsizlik, fikirlərindəki ziddiyyət, hərəkətlərindəki hoqqabazlıq haqqında olan fikrimi tamamilə dəyişdirmişdi*. A.Şaiq. [Mirzağa] *atasının hər sözündə və söhbətində bir məntiqsizlik görürdü.* S.Hüseyn.

**MƏNTİQŞÜNAS** *is.* [*ər.* məntiq və *fars.* ...şünas] Məntiq elmi ilə məşğul olan alim, məntiq mütəxəssisi; məntiqçi.

**MƏNTİQŞÜNASLIQ** *is.* Məntiq elmi ilə məşğul olma, məntiqşünasın ixtisası.

**MƏNZƏRƏ** *is.* [*ər.*] 1. Bir yerin uzaqlara qədər gedən ümumi görünüşü, gözün qavraya bildiyi yerin, sahənin, təbiətin görünüşü; axar-baxar. *Dağ mənzərəsi. Meşə mənzərəsi. – Mənzərələr tez-tez dəyişirdi: gah göy ot və çəmən, gah yaşıl təpələr və dağlar, gah qaranlıq meşələr və dərələr..* S.S.Axundov. *Furqon Ağsudan ötüb çaya yaxınlaşanda ayrı bir mənzərə müşahidə olundu.* Mir Cəlal.

2. Təbiəti əks etdirən şəkil, rəsm. *Təbiət mənzərələri. –* [Lətifə:] *Sizin dağlardan çəkib gətirdiyiniz mənzərələr çox gözəldir!* M.Hüseyn. // Bədii əsərlərdə təbiətin təsviri. *Nizaminin əsərlərində mənzərələr.*

3. *məc.* Konkret şəkildə təsəvvür olunan, göz qabağına gətirilə bilən şey, hadisə və s. *Keçmişin mənzərələri. Yürüş mənzərələri. Axşam mənzərəsi. – Tacirlərin və əsnafın abı, yaşıl, qara çuxaları qəribə bir mənzərə təşkil edirdi.* Çəmənzəminli. *Kosa qapının açar yerindən bu mənzərəni görürdü.* S.Rəhimov.

**MƏNZƏRƏÇİ** *is.* Mənzərə şəkilləri çəkən (rəssam). *Mənzərəçi rəssam.*

**MƏNZƏRƏLİ** *sif.* Gözəl mənzərəsi olan; axar-baxarlı. *Mənzərəli dərə. Mənzərəli təbiət. Mənzərəli çəmən. –* [Murad] *yüksək bir yerdə oturdu. Burası mənzərəli bir yer idi.* S.Hüseyn.

**MƏNZİL** *is.* [*ər.*] 1. Yaşayış evinin adətən bir neçə otaqdan, mətbəxdən və s.-dən ibarət olan hissəsi. *Təzə mənzilə köçmək. Üçotaqlı mənzil. –* [Tahir] *ikiotaqlı mənzilində cəmisi bir həftə qalmışdı.* M.Hüseyn. // Ümumiyyətlə, ev, birinin yaşadığı yer, otaq, məskən. *Mənzili qaydaya salmaq. – Əhvalatı başdan deyim: – Məşədi Həsənlə .. gəldik mənim mənzilimə.* Ə.Haqverdiyev. *Mirzə Cəmilin mənzilində bəzən səhərə kimi çıraq yanırdı.* Ə.Vəliyev. □ **Mənzil etmək** – yaşamaq üçün düşmək, bir yerdə qalmaq. *Mehmanxanada mənzil etmək. –* [Tacir] *bir karvansarada mənzil edir.* (Nağıl).

2. Gedilən yolun bölündüyü hissələrdən hər biri; mərhələ. *Bir mənzil yol getmək. – İki mənzili bir gündə gedirdilər.* M.S.Ordubadi. // Gedilən yer, yolun sonu. *Mənzilə çatmaq. – Yetişib mənzilə dayandı qayıq; Söndü yavaş-yavaş motorun səsi.* S.Vurğun. [Nizami] *.. günbatana mənzilə yetişəcəyini güman edirdi.* Ə.Məmmədxanlı. □ **Mənzil başı** – gedilən yer. *Mənzil başına çatmaq.* // Ümumiyyətlə, yol, məsafə. *Bir aylıq mənzili bir gündə kəsər; Köhlən bəsləmişəm görək Qıratım.* "Koroğlu". *Cənab uryadnik, Çullu çox uzaq mənzildir.* S.Rəhimov. **Mənzil etmək** – yolda istirahət üçün bir yerdə dayanmaq, düşmək. *Köç mənzil eləyib, heyvanları düzə buraxmışdı.* Ə.Haqverdiyev. *Edərdi orada bir gecə mənzil; Anıb o günləri, fikri dolandı.* H.K.Sanılı. **Mənzil kəsmək** – lazım olan yerə çatmaq, yolu başa çatdırmaq, qət etmək. *Arpa yemiş at mənzil kəsər*. (Ata. sözü). *Yedəyi köhlən atlı çapar mənzil kəsib, özünü Hatəm xanın malikanəsinə çatdırdı.* S.Rəhimov.

3. Körpü kimi tikililərdə, qurğularda qonşu dayaqlar arasındakı məsafə, ara.

4. Güllənin, mərminin gedib hədəfi vura biləcəyi məsafə.

**MƏNZİLBƏMƏNZİL** *zərf* Bir mənzildən o biri mənzilə qədər; yol gedərkən arada mənzil edə-edə. *İlyas bir aylıq yolu on günə gedib, mənzilbəmənzil gəlib çatdı Məstana.* (Nağıl).

**MƏNZİLGAH** *is.* [*ər.* mənzil və *fars.* ...gah] *klas.* Yaşayış yeri; mənzil. *Nə bilsin bəhr halın ol ki, mənzilgahı sahildir.* Füzuli.

**MƏNZİLLİ** *sif.* 1. Saylarla işlənərək binanın neçə mənzildən ibarət olduğunu bildirir. *50 mənzilli bina.*

2. Eyni mənada körpü haqqında. *Üç mənzilli körpü.*

3. Uzaqvuran, kəsərli (tüfəng haqqında). *Yaman mənzilli tüfəngdir.*

**MƏNZİL-MƏNZİL** b a x **mənzilbəmənzil**.

**MƏNZİLSİZ** *sif.* Mənzili olmayan, yaşayış yeri, evi olmayan. *Mənzilsiz adam.*

**MƏNZİLSİZLİK** *is.* Mənzilsiz adamın halı və vəziyyəti. *Mənzilsizlikdən əziyyət çəkmək.*

**MƏNZUM** *sif.* [*ər.*] Nəzmə çəkilmiş, nəzmlə (şeirlə) yazılmış (*mənsur* əksi). *Mənzum hekayə. – Teymur Mirzənin xahişinə görə Mirzə Əliqulu da öz mənzum əsərlərindən bir neçəsini oxudu.* C.Məmmədquluzadə.

**MƏNZUMƏ** *is.* [*ər.*] Mənzum hekayə, dastan, poema. [Səttar] *.. Sonanın şirin dili ilə mənzumənin .. birinci beytini oxudu və dişsiz ağzı ilə güldü.* Ə.Əbülhəsən.

**MƏNZUR** *is.* [*ər.*] *klas.* Nəzərdə tutulan, arzu edilən şey; məqsəd, niyyət. *Buna nə düşübdür ki, yalan danışsın və yalan danışmaqdan onun mənzuru nə ola bilər?* Ə.Haqverdiyev. ☐ **Mənzur olmaq** *klas.* – birinin diqqətinə, hüsn-rəğbətinə, təvəccöhünə nail olmaq. *Bir kimsəyə xurşidi-camalın ola mənzur; Mehri-fələkə meyil qılıb ayə baxarmı?* Q.Zakir.

**MƏRAM** *is.* [*ər.*] İstək, arzu, dilək, tələb. *Məramı həyata keçmək.* // Məqsəd, niyyət, qəsd. *Məramına çatmaq.* – [Molla Həmid:] *Hələ buyurun görək zəhmət çəkmənizdən qərəz məhz o cənabın ziyarətidir, ya başqa məramınız var?* M.F.Axundzadə. *Özgə bir məram ilə mən buraya gəlmişəm.* Ə.Haqverdiyev. *Noğul xanımın məramı bu idi ki, sözləri eşitdikdə Nadirin onlara rəhmi gəlsin.* B.Talıblı.

**MƏRAMNAMƏ** *is.* [*ər.* məram və *fars.* ...namə] Siyasi partiyanın, dövlət hakimiyyəti mərkəzi orqanının, ictimai təşkilatın, ya da dövlət və ictimai xadimin qarşısına qoyduğu məqsəd və vəzifələrini bəyan edən sənəd; proqram. *İndi görək bu firqənin məramnaməsi nədir?* C.Məmmədquluzadə. *Azərbaycan demokrat firqəsinin .. Təbrizdə çağırılmış birinci qurultayı firqənin məramnamə və nizamnaməsini təsdiq etdi.* M.İbrahimov. // *köhn.* Teatr, tamaşa, konsert proqramı.

**MƏRASİM** *is.* [*ər.* "rəsm" söz. cəmi] Qəbul və ya müəyyən olunmuş qayda və üsullarla icra edilən təntənə, ya başqa adət, ənənə. *Bayram mərasimi. Nişan mərasimi.* – *Əqdnikah mərasimi olduqca təntənəli keçdi..* Çəmənzəminli. *Aslan bütün gecəni yatmayıb dəfn mərasiminin vaxtını və yerini fəhlə yoldaşlarına xəbər verəndən sonra məscidə yola düşdü.* M.Hüseyn. *Hər şey ürəkaçıcı idi, sanki bütün kənddə bayram, toy mərasimi vardı.* S.Vəliyev.

**MƏRBUT** *sif.* və *zərf* [*ər.*] *köhn.* Bağlı, rabitəli, əlaqəli, əlaqədar. [Oqtay:] *Daha zəif bir rus aktrisası bir Tatyananı daha az zəhmətlə, daha gözəl oynaya bilər. Çünki ruhu haman mühit ilə mərbutdur.* C.Cabbarlı.

**MƏRC** *is.* Bir şey üstündə mübahisə edən iki nəfər arasında bağlanan və uduzan tərəfin yerinə yetirməli olduğu bir şeyi nəzərdə tutan şərt. [Dəli Həsən:] *Axırda ki, heç olmasa, bircə dəfə mərci biz apardıq.* "Koroğlu". ☐ **Mərc etmək (bağlamaq, tutmaq)** – bir şərt bağlamaq. *Çox vaxt nökərlər .. mərc edər və pəncərəni nişan alardılar.* Çəmənzəminli. *..Əl-ələ verib mərc tutanların qolu boşalmışdı.* B.Bayramov.

**MƏRCAN** *is.* [*ər.*] 1. *zool.* Dənizin dibində qayalara yapışaraq dəstələr şəklində hərəkətsiz yaşayan dəniz heyvanı. *Süngər, polip, mərcan və sair bu kimi heyvanlar bir yerə yapışaraq yaşayır.* M.Qasımov. *Mərcanlar Yer kürəsinin ən qədim heyvanlarıdır.* "Sualtı aləm".

2. Daşlaşmış halda olan həmin heyvanın bəzi növlərinin işləndikdən sonra bəzək şeyləri qayırmaq üçün istifadə edilən al-qırmızı, çəhrayı və ya ağ rəngli əhəng çöküntüsü. // Həmin daşdan hazırlanan bəzək şeyi. *Mərcan taxmaq. Mərcanı sapa düzmək.* – *Ələsgər qurbandı, a boyu minə! İncidən, mərcandan düzüb köksünə.* Aşıq Ələsgər. *İncini mərcandan seçən göz gərək; Həyata baxasan gözlüksüz gərək.* B.Vahabzadə. // *məc.* Obrazlı təşbehlərdə al-qırmızı mənasında. *Yüz lalə yanaqlı, ləbləri mərcan; Könül dönməz səndən kimsəyə, Pəri!* M.P.Vaqif.

**MƏRCANI** 1. B a x **quşüzümü**.

2. *sif.* Qırmızı rəngli; qırmızı. *Hamamın qapısından qırmızı mərcanı fitə asardılar ki, yoldan ötən və şeypur səsi eşitməyən kişilər hamamın zənanə olduğunu bilsinlər.* H.Sarabski.

**MƏRCANQULU** *is.* Bəzi onurğasız heyvanların əsasən qıvrım və ya oval laylı qutucuq şəklində olan qoruyucu bərk qabığı.

**MƏRCANOTU** *is. bot.* Əsasən meşələrdə bitən, tərkibində aşı maddəsi olan ot-bitki. *Dərmanbalotu, mərcanotu .. meşələrdə bitir. Tərkibində acı maddə və aşı maddəsi vardır.* M.Qasımov.

**MƏRCANVARİ** *sif.* Mərcana bənzər, mərcana oxşar, mərcan kimi.

**MƏRCƏK** *is.* Qulağın aşağı ətli hissəsi.

**MƏRCİ** *is.* 1. *bot.* Paxlalılar fəsiləsindən dənli bitki.

2. Həmin bitkinin xörəkdə işlədilən toxumu. *Şorbaya mərci tökmək.*

**MƏRCİÇİLOV** *is.* Mərci ilə bişirilən çilov.

**MƏRCİLİ** *sif.* Tərkibində mərci olan, mərci tökülmüş, mərci ilə bişirilmiş. *Mərcili plov. Mərcili xörək.*

**MƏRCİMƏK** bax **mərci**. *Mərci və ya mərcimək .. növünün toxumundan yeyinti məhsulu kimi istifadə edilir və ya yem olaraq heyvanlara verilir.* M.Qasımov.

**MƏRCİMƏKLİ** bax **mərcili**. *Mərciməkli şorba.*

**MƏRCİPLOV** *is.* Mərci ilə bişirilən plov növü. *Mərciplov bişirmək.*

**MƏRCLƏŞMƏ** "Mərcləşmək"dən *f.is.*

**MƏRCLƏŞMƏK** *f.* Mərc çəkmək, mərc gəlmək, mərc tutmaq, çəkişmək. *Qızlar mərcləşdilər.*

**MƏRD** *is.* [*fars.*] 1. Kişi. *Çarpışmaq üçün lazım ikən mərdə cəsarət; Bilməm neçin olmuş sana qalib əsəbiyyət.* H.Cavid. *Üç nəfər mərd sahibi-iyman; Üçü bir yerdə etdilər peyman.* Ə.Qəmküsar.

2. *məc.* Sözündə, əhdində möhkəm olan adam; vəfalı, etibarlı; alicənab. *Mərdlər ilən gəz ki, vəfadar olur; Nakəslərə yoldaş olan xar olur.* M.V.Vidadi. *Koroğlu əyilməz yağıya, yada; Mərdin əskik olmaz başından qada.* "Koroğlu". // Sif. mənasında. [Uluq bəy:] *Çeşmədən durusan, şəfəqdən oynaq; Belə mərd qızlarla gülər hər ocaq.* A.Şaiq.

3. İgid, qəhrəman, cəsur, qorxmaz adam. *Bir badə zəhəri o mərd içərək; Dedi: – Azadlıq çal! – bir kamandara.* S.Vurğun. // Sif. mənasında. *Bu insan selinin qarşısında tək; Dayandı Qafqazın mərd oğulları*. S.Vurğun. *Yüksəlsin qoy səsi mərd insanların; Azadlıq hər yerdə qələbə çalsın!* N.Rəfibəyli.

**MƏRDANƏ** *zərf* və *sif.* [*fars.*] 1. İgidcəsinə, qəhrəmancasına, qorxmadan. *Mərdanə vuruşmaq.*

2. Mərdcəsinə, açıqcasına. *Mərdanə danışmaq. – Başımı top edib yenə meydanə girmişəm; Meydanə girməyə yenə mərdanə ər gərək.* Nəsimi.

3. Kişiyə xas olan, kişiyə məxsus, kişi üçün olan. *Mərdanə paltar. – Bir gün, cümə günü bir cüt mərdanə corab bazardan alıb, oğlunu yanına salıb getdi Mirzə Nəsibin evinə.* Ə.Haqverdiyev. *Hətəmxanın çiynində göy mahud çuxa, .. ayağında iri nallı mərdanə başmaq var idi.* S.Rəhimov. // *məc.* Kişi kimi, kişi tərzində. *Qızın sifətindəki mərdanə gözəllik, .. sərrastlığı, danışığındakı cazibə* [Səlimin] *gözündən qaçmamışdı.* B.Bayramov.

**MƏRDANƏLİK** 1. *is.* Mərdlik, kişilik, alicənablıq; igidlik. *Onların səxavət və mərdanəliyi məni çoxdan bəri özlərinin məddahı etmişdir.* M.S.Ordubadi.

2. **Mərdanəliklə** şəklinlə *zərf* – mərdcəsinə, mərd kimi, kişi kimi, qoçaqcasına. *Mərdanəliklə vuruşmaq.* – [Musa:] *Kişi gərək hər müsibətə mərdanəliklə davam eləyə.* Ə.Haqverdiyev.

**MƏRDİMAZAR** *sif.* və *is.* [*fars.* mərdümazar] Danışığı və ya hərəkəti ilə başqasına zərər vuran, ziyan yetirən, pislik, yamanlıq edən. *Mərdimazar adam.* // Söyüş məqamında. [Soltan bəy:] *Mərdimazar oğlu mərdimazar hayandan gəldisə, bütün işi korladı, planımı dağıtdı.* Ü.Hacıbəyov. [Allahqulu:] *Nə eləyəsən ki, yolu mərdimazar ləzgi qaçaqları kəsdilər.* Çəmənzəminli. [Cavanlardan biri:] *Mərdimazarın ölüsü də, dirisi də mərdimazardır.* B.Bayramov.

**MƏRDİMAZARLIQ** *is.* Başqasına ziyan vurma, zərər yetirmə, pislik eləmə; pislik, yamanlıq. *Mərdimazarlıq yaman işdir; Belə qalmaqdan ölməyin xoşdur.* S.Ə.Şirvani. *Söz yox ki, qonşuluqda bir belə mərdimazarlıq əmioğluna yaraşan şey deyildir.* C.Məmmədquluzadə. ☐ **Mərdimazarlıq etmək (eləmək)** – pislik etmək, ziyan yetirmək, zərər vurmaq. [Zeynal:] *Dövlətlilərdən mərdimazarlıq eləyəni-zadı olar birdən!* Ə.Əbülhəsən.

**MƏRDİMGİRİZ** *sif.* [*fars.*] Adama yovuşmayan, adamdan qaçan, adam sevməyən. *Mərdimgiriz adam.* – [Rüstəm bəy:] [Həsən] *bir qədər mərdimgirizdir, çox oxuyub, deyən, bir qədər başı xarab olubdur.* Ü.Hacıbəyov. [Şeyx Sənan:] *Nə var mərdimgiriz olmaqda, bilməm; Nolur olsan bizə həmrah, həmdəm?* H.Cavid.

**MƏRDİMGİRİZLİK** *is.* Adamdan qaçma, adama yovuşmamazlıq, adam sevməməzlik.

**MƏRDLİK** *is.* 1. Sözündə, işində etibarlı, vəfalı olma; sədaqət, vəfa, etibarlılıq, kişilik, alicənablıq. [Firəngiz Muxtara:] *..Mərdlik, qeyrət və sədaqət sıldırımlardan da atılsa, ölməzdir, əbədidir!* B.Bayramov.

2. İgidlik, qəhrəmanlıq, şücaət. *Döyüşçülərimizin mərdliyi. – Koroğlu mərdliyi qala dünyada; İgid gərək başda sevda qaynada.* "Koroğlu". *Yalnız adın igid deyil; Mərdlik, hünər özü səndə!* N.Rəfibəyli.

**MƏRD-MƏRDANƏ, MƏRDÜ MƏRDANƏ** bax **mərdanə** 1 və 2-ci mənalarda. *Mərd-mərdanə vuruşmaq. Mərd-mərdanə döyüş meydanına atılmaq. – Başlar kəsdi, qollar qırdı, mərd-mərdanə dava elədi.* "Koroğlu". *Kərəm çəkər cəfa mərdü mərdanə; Bivəfa əlindən gəlmişəm cana.* "Əsli və Kərəm". // Açıqcasına, heç bir şeydən çəkinməyərək, kişi kimi. *Mərd-mərdanə sözü üzünə açıq demək.*

**MƏRƏ** *is.* Mərə-mərə oyunu üçün qazılan çuxur, oyuq. *Qozu mərəyə atmaq. Daş mərəyə düşdü.* // Ümumiyyətlə, çuxur yer, dərə. *Birinci mərədən sağ-salamat çıxıb gəlir.* Ə.Əbülhəsən.

**MƏRƏK** *is.* 1. Saman, alaf və başqa heyvan yemlərini yığmaq üçün örtülü yer; anbar, samanlıq. *Mərəkdən yonca götürmək. – ..İtələnən saman çox asanlıqla mərəyin üst bacalarından içəriyə tökülürdü.* S.Rəhimov. *Atın arpası çuvallardadır, mərəyin açarı da un xaralının üstündə.* Ə.Vəliyev.

2. "Talvar, çardaq" mənasında. *Çox isti havalarda heyvanlar otlaqlardakı düşərgələrdə yüngül mərəklərin altında, yaxud kölgəli yerlərdə saxlanmalıdır.* A.Ağabəyli.

**MƏRƏKƏ** *is.* [*ər.*] 1. Səs-küy, qışqırıq-bağırıq, qalmaqal, hay-küy, qovğa, qiyamət. *Mərəkə qopmaq. – Otağa böyük mərəkə düşür, qızlar başlayırlar ağlamağa.* C.Məmmədquluzadə. *Vay o gündən ki, bir arvad iş görəndə döşlük taxmaya, Gülsabah bunun üstündə yekə bir mərəkə düzəldir.* Ə.Vəliyev. // Dava-dalaş, qovğa, həngamə. *Mərəkədə başda duran; Meydanda igidlər yoran.* "Koroğlu". *Ona binaən Yusif şahın həvaxahları şikəst tapıb hər kəs bir növ ilə başın mərəkədən qıraq çəkdi, canın qurtardı.* M.F.Axundzadə. *Harada arvad davası görsəm, hər halda lap vacib işimi qoyub gərək bu mərəkə və qovğanın axırına çatam.* Qantəmir.

2. Məclis, yığıncaq. [Ruqiyyə:] *..Mərəkə yığıldı, bu da Aşıq Qəribdən, Koroğludan, Kərəm ilə Əslidən danışıb türkü söylədi.* A.Divanbəyoğlu. *Nə kəndliləri lağa qoyan baqqallar, nə dərviş mərəkəsi var.* Mir Cəlal.

**MƏRƏKÖÇDÜM** bax **mərə-mərə**. [Gülüqız:] *Gəl oturaq, sənə iki təzə oyun öyrədim. Birinin adı mərəköçdümdür.* Ə.Vəliyev.

**MƏRƏ-MƏRƏ** *is.* Qoz, fındıq, daş və s.-ni mərəyə salmaqdan ibarət uşaq oyunu. *Mərə-mərə oynamaq.*

**MƏRƏNDİ** *is.* Azərbaycanda qiymətli süfrə üzümü.

**MƏRƏZ** *is.* [*ər.*] 1. Xəstəlik, naxoşluq, azar. *Hər mərəz çarəsini eyləmək asandır, təbib! Mərəzi-eşqə nə tədbir, nə dərmanın var?* M.Ə.Sabir. [Gülbadamın] *uşaqlıqdan çiçək mərəzinə mübtəla olmağı üzündən məlum edirdi.* N.Nərimanov.

2. *məc.* "Adət, vərdiş" mənasında. *Deyinmək onun mərəzidir. – Mətləb Mozalan kəndinin sümüyündə olan bu mərəz üstündədir.* S.Rəhimov. *Bağır Cabbarzadə ilə zarafat eləmək bir mərəz idi və bu mərəz Cəfərə də sirayət eləmişdi.* S.Rəhman.

3. Altıaylıq tazı. *Tazı altı ayda mərəz olardı, yəni tazılıq həddinə çatardı.* H.Sarabski.

**MƏRƏZLİ** *sif.* Mərəzi, xəstəliyi, azarı olan.

**MƏRGMÜŞ** *is.* [*fars.*] Bir çox mineralların tərkibində olan zəhərli bərk maddə – kimyəvi element. // Həmin maddədən alınan preparat (tibb və texnikada işlənir).

**MƏRGMÜŞLÜ** *sif.* Tərkibində mərgmüş olan. *Mərgmüşlü kolçedan. – ..Culfa şəhərində çıxan mərgmüşlü Darıdağ suyunun .. müalicə əhəmiyyəti vardır.*

**MƏRHƏBA** *nida* [*ər.*] Bəyənmə, tərif bildirir – afərin! barakallah! eşq olsun! əhsən! *Eşidənlər kəlamın olsun şad; Söyləsinlər ki, mərhəba, ustad!* S.Ə.Şirvani. *Dərəcək dadlı meyvələr, yeyəcək; Mənə min dəfə mərhəba deyəcək.* A.Səhhət.

**MƏRHƏLƏ** *is.* [*ər.*] 1. Bir şeyin inkişafında keyfiyyətcə öz xüsusiyyətləri olan dövr, moment. *İnkişafın yüksək mərhələsi. Müəyyən mərhələ. – Azərbaycan dramaturgiyasının inkişafında C.Məmmədquluzadənin komediyaları xüsusi bir mərhələ təşkil edir.* M.İbrahimov. *Plantasiyada işin başqa mərhələsi başlanmışdı.* H.Seyidbəyli.

2. *köhn.* Birgünlük yol, iki mənzil arası.

3. *klas.* Yer. *Mümkün deyil, Füzuli, cahanda iqamətin; Bihudə sən bu mərhələdə məskən eylədin.* Füzuli. *Seyid, qayıt bu mərhələdən, kəs ayağını; Axır bu rahimeygədənin bir məalı yox.* S.Ə.Şirvani.

**MƏRHƏM** bax **məlhəm**. *Onunla edin bu dərdə mərhəm.* Füzuli. *Mərhəm olurdu, sağalırdı yara; Əldə qalırdı yenə can sağbasağ.* M.Ə.Sabir. *Səqfə dəyən yağışın güclü, ahəngdar və boğuq səsi Salamın əsəblərinə mərhəm kimi xoş idi.* Mir Cəlal.

**MƏRHƏMƏT** *is.* [*ər.*] Rəhm, şəfqət, acıma, insaf hissi. [Bəxtiyar:] *Sən boş yerə çəkmə zəhmət; Saraydan umma mərhəmət!* A.Şaiq. [Bənövşə:] *Məndən heç bir mərhəmət gözləmə, Camal!* S.Rəhman. □ **Mərhəmət etmək (eləmək)** – rəhm etmək, rəhmi gəlmək, acımaq, yazığı gəlmək, insaf etmək. *Danışdıq, barışdıq, mərhəmət eylə; İnciklik araya qatma, hayıfsan!* Aşıq Ələsgər. *Yabançı əllərdə qalan Mil düzü! Bir kimsə etməmiş sənə mərhəmət.* M.Müşfiq. **Mərhəmət qılmaq** – bax **mərhəmət etmək (eləmək)**. *Tez mərhəmət qılıb bir ehsan eylə; Sevdiyim, üzündən at indi niqab.* Aşıq Abbas.

◊ **Mərhəmətin(iz) artıq (olsun)!** – yaxşılıq müqabilində təşəkkür ifadəsi. [Pərviz xan:] *Mərhəmətiniz artıq (olsun)!.. Sayəniz kəm olmasın.* M.S.Ordubadi.

**MƏRHƏMƏTLİ** *sif.* Ürəyi nazik, rəhmli, şəfqətli, acıyan, rəhm və şəfqəti çox. *Mərhəmətli adam.* – [Rüxsarə] *axşamdan sübhə qədər .. mərhəmətli əlini xəstənin başına qoymuşdu.* S.Rəhimov.

**MƏRHƏMƏTLİLİK** *is.* Mərhəmətli olma; rəhmlilik, şəfqətlilik.

**MƏRHƏMƏTSİZ** *sif.* Mərhəmət etməyən, rəhmi gəlməyən; insafsız, daşürəkli, rəhmsiz. *Mərhəmətsiz adam.*

**MƏRHƏMƏTSİZLİK** *is.* Mərhəmətsiz olma; rəhmsizlik, şəfqətsizlik, daşürəklilik, insafsızlıq.

**MƏRHUM** *sif.* [*ər.*] Ölmüş, vəfat etmiş, rəhmətə getmiş. [Xudaverdi:] *Xeyr, mən soruşuram ki, mərhum atanızın adı nədir?* M.F.Axundzadə. [Süleyman:] *Mərhum bəzzaz Mürsəli deyirəm ki, gözəl kişilərin birisi idi.* Ü.Hacıbəyov. // İs. mənasında. *Mərhum yaxşı adam idi. – Qoqolun xidməti rus millətinə o dərəcədə olub ki, mərhumun doğulmağının yüz illiyini Rusiyada kəndlərdə də mujiklər eşidiblər.* C.Məmmədquluzadə. [Mahmud bəy:] *O mərhum məni çox istəyirdi.* N.Vəzirov. □ **Mərhum olmaq** – ölmək, vəfat etmək, rəhmətə getmək. [Soltan bəy:] *Mənim də arvadım, budur, beş ildir ki, mərhum olubdur.* Ü.Hacıbəyov. *Dörd il Cəlil bu dükanda qulluq edəndən sonra bunun anası Zəhra mərhum oldu.* İ.Musabəyov.

**MƏRİFƏT** *is.* [*ər.*] 1. Ədəb, tərbiyə, qanacaq, kamal. *Qızın mərifəti. – Qabiliyyətdə, mərifətdə, kamalda; Bu cahanda sənin kimi can olmaz.* Aşıq Ələsgər. *Paşa bəy pristavı ağıldan kəm, qorxaq saydığı kimi, onun qanacaq və mərifətinə də xor baxırdı.* Ə.Vəliyev.

2. Elm, maarif, mədəniyyət. [Möhtərəm şəxslər kənddə] *mərifət çırağını yandırıb, əhalinin gözlərini açıb; mənəvi tərəqqilərinə bais olublar.* F.Köçərli.

**MƏRİFƏTLİ** *sif.* 1. Mərifəti olan; qanacaqlı, tərbiyəli, kamallı, ləyaqətli. *Mərifətli qız. Mərifətli uşaq. – Mənim gözəl və mərifətli mələkəm, sizin bu qədər acıqlanmağınızın səbəbi nədir?* M.S.Ordubadi. *Usta Pirəli, oğlunun mərifətli cavabını bəyənib, istər-istəməz yumşaldı.* M.Hüseyn.

2. Oxumuş, təhsilli, mədəni. [Niyaz bəy:] *Çünki zəmanəmiz belə zamandır ki, mədəniyyətli və mərifətli qulluq adamları bizim müftəyeyən bəylərdən əfzəldirlər.* N.Nərimanov.

**MƏRİFƏTLİLİK** *is.* Mərifət sahibi olma; qanacaqlılıq, ədəblilik, tərbiyəlilik.

**MƏRİFƏTSİZ** *sif.* 1. Mərifəti olmayan; qanacaqsız, tərbiyəsiz, ədəbsiz, nəzakətsiz, ləyaqətsiz.

2. Cahil, elmsiz, mədəniyyətsiz. *O bir neçə kərə o tərəf-bu tərəfə getdikdən sonra salondakıları gözdən keçirib dedi: – Alçaqlar! İdraksızlar, mərifətsiz, şüursuz tör-töküntülər!..* M.S.Ordubadi.

**MƏRİFƏTSİZLİK** *is.* Mərifəti olmama; qanacaqsızlıq, ədəbsizlik, nəzakətsizlik, tərbiyəsizlik. [Usta Ağabala] *camadarın mərifətsizliyinə etina etməyib, qapının müqabilində olan isti su hovuzuna tərəf rəvan oldu.* Çəmənzəminli.

**MƏRİZ** *is.* [*ər.*] Xəstə, naxoş, azarlı. *Dəlilər dəxil düşür; Mərizlər Loğmana gəlir.*

Aşıq Ələsgər. *Bədənin nisfi məriz olsa əgər; Göstərərmi bu bədən fəzlü hünər?* M.Hadi. [İskəndər bəy:] *Dəli də məriz deyilmi?* N.Vəzirov.

**MƏRİZXANA** *is.* [*ər.* məriz və *fars.* ...xanə] *köhn.* Xəstəxana. *Kəndlərimizdə .. nə aczaxana, nə mərizxana və nə elmli həkim və cərrah gözə dəymir.* F.Köçərli. *..Xərclərə bir az qənaət edib və bir qədər də üstə qoyub bəlkə bir mərizxana, ya bir məktəb açsınlar.* C.Məmmədquluzadə.

**MƏRİZLİK** *is.* Xəstəlik, naxoşluq.

**MƏRKƏZ** *is.* [*ər.*] 1. *fiz. riyaz.* Fiqurda hər hansı oxların, xətlərin kəsişdiyi nöqtə, bir cisimdə hər hansı nisbətlərin toplaşdığı nöqtə. *Təzyiq mərkəzi. Dairənin mərkəzi. Simmetriya mərkəzi. Ellipsin mərkəzi.*

2. Hər hansı bir şeyin ortası, orta hissəsi. *İzdihamın mərkəzi.* // Şəhərin, adətən ortasında olan və inzibati binaların, əsas ticarət və bank idarələrinin və s. yerləşdiyi hissəsi. *Şəhərin mərkəzi.* // Mərkəzi. *Qəzənfər .. şəhərin mərkəz küçəsinə yaxınlaşdı.* S.Vəliyev.

3. Hər hansı bir işin, rəhbərliyin, idarənin mərkəzləşdiyi yer. *Şükür əvvəllərdə Güləlinin əsgərliyə alınmasını bir yanlışlıq zənn etmişdi. Hətta onun anasının dilindən mərkəzə bir ərz-hal da yazmışdı.* S.Hüseyn. [Səriyyə] *əvvəlcə* [Nuriyyəni] *mərkəzdən gəlmiş təhkimçi hesab etdi.* İ.Əfəndiyev.

4. Hər hansı bir yer, ölkə və s. üçün inzibati, sənaye, mədəni və b. cəhətdən əhəmiyyəti olan şəhər, böyük yaşayış məntəqəsi. *İnzibati mərkəz. Ticarət mərkəzi. – Sərxan tez-tez qəza mərkəzinə gedib-gəlirdi.* M.Hüseyn. *Rayon mərkəzindən çıxıb sola burulanda pöhrəliyin ortası ilə dolayı yol uzanır.* Ə.Vəliyev.

5. Hər hansı bir işi idarə edən ali rəhbərlik orqanı (orqanları). *Mərkəzin göstərişi. Mərkəzdən alınan direktivlər.*

6. Müəyyən işlə məşğul olan bəzi idarə və ya şöbə adlarının tərkibində işlədilir. *Televiziya mərkəzi. Elmi informasiya mərkəzi. Sinoptika mərkəzi.*

7. *fiziol.* Orqanizmin bu və ya başqa vəzifəsini tənzim edən sinir hüceyrələri qrupu. *Hərəkət mərkəzi. Tənəffüs mərkəzi.*

8. Parlamentlərdə: (sağlarla sollar arasında) aralıq partiyalar və qrupların adı.

**MƏRKƏZÇİ** *is.* Mərkəzçilik tərəfdarı.

**MƏRKƏZÇİLİK** *is. tar.* II İnternasional partiyalarında opportunizmin ən maskalanmış və örtülü forması.

**MƏRKƏZDƏNQAÇAN** *sif. xüs.* Hərəkət zamanı mərkəzdən kənarlara yönələn, qaçan (*mərkəzəqaçan* əksi). *Mərkəzdənqaçan qüvvə.* // Hərəkəti mərkəzdən kənara yönəldən qüvvə əsasında qurulmuş. *Mərkəzdənqaçan nasos.*

**MƏRKƏZƏQAÇAN** *sif. xüs.* Hərəkət zamanı mərkəzə doğru yönələn, qaçan (*mərkəzdənqaçan* əksi). *Mərkəzəqaçan qüvvə.*

**MƏRKƏZİ** *sif.* [*ər.*] 1. Mərkəzdə, ortada olan. *Şəhərin mərkəzi hissəsi. – Səfarətxananın maşınları bizi tozlu yollardan keçirərək mərkəzi küçələri daşla döşənmiş şəhərə gətirir.* M.İbrahimov.

2. Əsas, ümdə sayılan, ən mühüm. *Mərkəzi rollarda çıxış etmək. – "Molla Nəsrəddin" in din əleyhinə mübarizəsi bütün feodal-patriarxal və burjua-meşşan həyata qarşı hərtərəfli mübarizənin mərkəzi məsələsi idi.* M.İbrahimov.

3. Rəhbərlik edən; baş. *Mərkəzi hakimiyyət orqanı. Həmkarlar ittifaqlarının mərkəzi komitəsi.* // Əsas vəzifələri, fəaliyyəti əlaqələndirmə, birləşdirmə vəzifəsini özündə cəmləşdirən. *Mərkəzi teleqraf. Mərkəzi seçki komissiyası.*

**MƏRKƏZİYYƏT** *is.* [*ər.*] Yerli təşkilatların (orqanların) mərkəzi hakimiyyət orqanına, mərkəzə tabeliyindən ibarət idarə və ya təşkilat sistemi.

**MƏRKƏZİYYƏTÇİ** *is.* Mərkəziyyət tərəfdarı.

**MƏRKƏZLƏNMƏ** "Mərkəzləmək"dən *f.is.*

**MƏRKƏZLƏMƏK** *f.* Bir ümumi ox ətrafında hər hansı cismin mərkəzi müəyyənləşmək, mərkəzə uyğunlaşmaq.

**MƏRKƏZLƏMƏ** "Mərkəzlənmək"dən *f.is.*

**MƏRKƏZLƏNMƏK** *f.* Bir mərkəz ətrafında toplanmaq, bir mərkəzə yığılmaq, cəmlənmək, cəmləşmək.

**MƏRKƏZLƏŞDİRİLMƏ** "Mərkəzləşdirilmək"dən *f.is.*

**MƏRKƏZLƏŞDİRİLMƏK** *məch.* Bir mərkəz ətrafında toplaşdırılmaq, bir mərkəzdə

cəmləşdirilmək. *Şagirdlərin diqqətləri proqram materialları üzrə aldıqları biliklər ətrafında mərkəzləşdirilməlidir.* (Qəzetlərdən).

**MƏRKƏZLƏŞDİRMƏ** "Mərkəzləşdirmək"dən *f.is.*

**MƏRKƏZLƏŞDİRMƏK** *f.* Bir mərkəzə bağlamaq; bir mərkəzə tabe etmək, bir mərkəzdə cəmləşdirmək, birləşdirmək, toplamaq.

**MƏRKƏZLƏŞMƏ** "Mərkəzləşmək"dən *f.is.*

**MƏRKƏZLƏŞMƏK** *f.* Bir mərkəzə yığılmaq, bir mərkəzdə cəmləşmək, birləşmək, toplanmaq.

**MƏRMƏR** *is.* [*lat.*] 1. Heykəltəraşlıqda və memarlıqda işlənən müxtəlif rəngli kristallik dağ süxuru – kirəc daş. *Ağ mərmər. Qara mərmər.*

2. *Sif. mənasında.* Mərmərdən düzəldilmiş, üzərinə mərmər çəkilmiş. *Mərmər heykəl. Mərmər pilləkən. Mərmər divar. – Binanın dörd tərəfi mərmər balkondan ibarət idi.* M.S.Ordubadi.

3. *Sif. mənasında.* Mərmər kimi ağ, hamar, parlaq. *Mərmər üz. Mərmər bədən. – Əziziyəm bağ sinə; Səyyad keçər, dağ sinə; Baxdım, huşum apardı; Mərmər buxaq, ağ sinə.* (Bayatı). *İsti olmağına görə qız ağ mərmər döşünü açmışdı və hərdənbir ətrafına baxıb guya ləzzət aparırdı.* N.Nərimanov.

◊ **Mərmər xul** *zool.* – yeyilən xul balığı növlərindən biri. *Mərmər xul – başının qalınlığı hündürlüyündən azdır. Çənələri eyni uzunluqdadır. Alnının eni gözünün diametrindən azdır.* Y.Əbdürrəhmanov.

**MƏRMƏRİK** *is. bot.* Yabanı gilənar. [Məhərrəm əmi:] *Qoşuldu bəzi avaralara, gah Cövüzlükdə gizlənpaç oynadı, gah Mırığın güneylərindən mərmərik dərməyə getdi.* Ə.Vəliyev.

**MƏRMİ** *is.* [*ər.*] Top kimi silahların gülləsi. *Birdən top mərmisi partladı, qara torpağı göyə sovurdu.* M.Hüseyn. *Göyü xəncər kimi mərmilər yarır.* M.Rahim. *Düşmənin mərmiləri sovurur göyə qarı.* Ə.Cəmil.

**MƏROVCA** *is. bot.* Yarpaqları topaşəkilli yeməli yabanı ot bitkisi. *Ballı, bacısı oğlu ilə birlikdə kəndin üst tərəfindəki güneylərə gedər, .. mərovca yığardı.* Ə.Vəliyev. *Yusifin .. mal otardığı yaz vaxtı kolların dibindən mərovca, quluncar .. dərdiyi yadına düşdü.* B.Bayramov.

**MƏRSİN** *is. bot.* Gözəl iyli yarpaqları olan həmişəyaşıl ağac. *Qara mərsin.*

**MƏRSİYƏ** *is.* [*ər.*] Ölmüş bir adamın yaxşı sifətlərini vəsf edən və əsasən yas yerlərində oxunan şeir növü. *Gər kəmalın var isə; Qumru kimi mərsiyə yaz.* S.Ə.Şirvani. *Bildir bizim kətdə o taydan* [gəlmiş] *bir molla mərsiyə oxuyurdu.* C.Məmmədquluzadə.

**MƏRSİYƏXAN** *is.* [*ər.* mərsiyə və *fars.* ...xan] *köhn.* Mərsiyə oxuyan adam. *Mərsiyəxan Kərbəla vaqiəsindən danışmağa, yalanlarla camaatı aldatmağa çalışırdı.* H.Sarabski. *Uzun qış gecəsi, sizdən naxoş, plovu yemişdik, ocaq, samovar, mərsiyəxan – hər şey və hamı dəmdə idi.* Qantəmir.

**MƏRSİYƏXANLIQ** *is. köhn.* Mərsiyəxanlıq işi, peşəsi. *Axund Fərzəlinin peşəsi mərsiyəxanlıqdır.* C.Məmmədquluzadə. [Fərəc:] *Nə üçün keçib Arazın o tayında mərsiyəxanlıq etməyim?* Qantəmir.

**MƏRTƏBƏ** *is.* [*ər.*] 1. Evin üst-üstə tikilmiş qatlarının hər biri; qat. *Evin üst mərtəbəsi. 5-ci mərtəbə.*

2. Bir səviyyədə, üfüqi vəziyyətdə yerləşmiş şeylər sırası.

3. *məc.* Rütbə, mənsəb, vəzifə, məqam, dərəcə. *Mərtəbəyə çatmaq. – Vali və onun müavini isə özlərinə mərtəbə qazanmaq məqsədilə yüzlərcə təqsirsiz adamın siyahısını ingilis və çar konsulxanalarına verirdilər.* M.S.Ordubadi. *Onlar dövlətin qayğısı və öz istedadları, əməkləri sayəsində bu mərtəbəyə çatıblar.* Mir Cəlal.

4. Miqdar, qədər, dərəcə. □ **Bir mərtəbədə** – o dərəcədə, o qədər. *Amma keyfiyyət bir mərtəbədə qərib idi ki, Yusif Sərrac onun doğru olmağına etibar edə bilmirdi.* M.F.Axundzadə. [Məhəmməd ağa:] *Nadanlıq gözlərini bir mərtəbədə kor edibdir ki, namümkündür, söz, nəsihət ilə bunlara bir şey qandırasan.* N.Nərimanov.

5. *klas.* Dəfə, kərrə. *İki mərtəbə getmək. – Ala gözlər nərgisi-məstanə tək şəhlalanır; Elə ki, süzgünləşir, yüz mərtəbə zibalanır.* M.P.Vaqif. *Həzar mərtəbə şirindi noğlu şəkkərdən.* S.Ə.Şirvani.

**MƏRTƏBƏARASI** *sif.* Mərtəbələrin arasında olan, iki mərtəbənin arasında yerləşən.

**MƏRTƏBƏCİK** bax **etajer(ka)**. *Gülyanaq protokola qol çəkib .. evin sağ küncündəki mərtəbəciyin üstünə qoydu.* Ə.Vəliyev.

**MƏRTƏBƏLİ** *sif.* Rəqəmlərdən sonra gələrək evin, binanın və s.-nin neçə mərtəbədən ibarət olmasını bildirir. *Bakıda 15-20 mərtəbəli binalar tikilir. – 4-5 mərtəbəli evlər uçulub dağılmışdır.* M.İbrahimov.

**MƏRTƏBƏ-MƏRTƏBƏ** *zərf* Bir mərtəbədən o biri mərtəbəyə, mərtəbədən-mərtəbəyə. *Mərtəbə-mərtəbə yuxarı qalxmaq. – Onun gövdəsinə sarılmış borular və mərtəbə-mərtəbə hərlənən dar dəmir pilləkənlər arasındakı kranlar diqqəti cəlb edirdi.* H.Seyidbəyli.

**MƏRTƏBƏYARIM** *sif.* Altında zirzəmisi olan; zirzəminin üstündə tikilmiş (ev, bina). *Mərtəbəyarım bina.*

**MƏRUF** *sif.* [*ər.*] *klas.* 1. Məlum, hər kəsin bildiyi, bilinən. *Elm afəti-can olduğu məşhuri-cahandır; Mərufi-zamandır.* M.Ə.Sabir.

2. Şöhrətli, tanınmış, məşhur. [Sitarənin] *mərhum atası Bakının məruf və tanınmış bir dövlətlisi idi.* S.Hüseyn. *..Məruf bir zat Azərbaycana gəldi, qeyri-rəsmi bir irtibat yaratdı.* M.İbrahimov. ◻ **Məruf olmaq** – məşhur olmaq, tanınmaq, adı çıxmaq. *O zaman ..* [azərbaycanlılardan] *rusca bilən az olduğu üçün Mirzə Səməd xalq arasında məruf olmuşdu.* Çəmənzəminli.

**MƏRUZ** *sif.* [*ər.*] 1. Bir şeyə düçar olan, ona qarşı müqavimət edə bilməyən, bir şeyə qarşı qoruyucusu olmayan. *Təhqirlərə məruz. Hücuma məruz. Xəstəliyə məruz.*

2. Əsasən "qalmaq", bəzən də "olmaq" feillərilə – tutulmaq, düçar olmaq, uğramaq, düşmək. *Təhlükəyə məruz qalmaq. İstilaya məruz qalmaq. – ..Gənc şair bir ani külək hücumuna məruz qalmış cavan bir ağac kimi yerində səndələdi.* Ə.Məmmədxanlı. [Aydın:] *Əvvəli budur ki, həmin xəstəliyə məruz olan yalnız Gülpəri deyil..* H.Seyidbəyli.

**MƏRUZƏ** *is.* [*ər.*] Bir mövzu haqqında irəlicədən hazırlanıb söylənilən nitq. *Hesabat məruzəsi. Məruzə ətrafında çıxışlar. Elmi məruzə. – Ənisə, titrəyən əllərilə qarşısındakı kağızları qarışdıraraq, məruzəsinin müqəddiməsini söyləyirdi.* S.Hüseyn. *Məruzə müvəffəqiyyətlə keçmişdi.* Ə.Sadıq.

**MƏRUZƏÇİ** *is.* Məruzə edən şəxs. *Məruzəçini dinləmək. Məruzəçiyə sual vermək.*

**MƏRVANİ** *is.* [*ər.*] Əməvilər sülaləsinin bir qolu.

**MƏRYƏMBÖCƏYİ, MƏRYƏMQURDU** *is. zool.* Rütubət yerlərdə yaşayan xərçəngəoxşar kiçik qurd (böcək).

**MƏRYƏMNOXUDU** *is. bot.* Azərbaycanın meşələrində bitən ot-bitki.

**MƏRYƏMOTU** *is. bot.* Tərkibində ətirli yağ olan ot-bitki. *Məryəmotu və ya süyürvə bitkisinin çiçəyi ikidodaqlı tacdan ibarətdir.* M.Qasımov.

**MƏRZ** *is.* [*fars.*] Tarla, bağ, bostan və s. sahəsini bir-birindən ayıran xətt; sərhəd. *Bostan mərzi. – İki bağın mərzində bulunan bir qarağacın kölgəsində iki ailə istirahət edib əylənirdi.* S.Hüseyn. *Aslan maşından düşüb ot-alaf basmış mərzləri adlayaraq pambıq sahəsinə çıxdı.* M.İbrahimov.

**MƏRZƏ** *is. bot.* Ətirli bir tərəvəz bitkisi.

**MƏRZLƏMƏ** "Mərzləmək"dən *f.is.*

**MƏRZLƏMƏK** *f.* Mərz çəkmək, mərz qoymaq, mərzlə ayırmaq. *Tarlaları mərzləmək.*

**MƏS** bax **məst²**. [Midhəd] *qapıda çəkmələrinin üstündən məs geydi..* Çəmənzəminli. [Səriyyə:] *Ayaqlarında .. məs, əynində qolları çiyninə qədər nazik və qısa don var idi.* İ.Əfəndiyev.

**MƏSAFƏ** *is.* [*ər.*] İki yerin, iki nöqtənin arası, aralarındakı uzaqlıq. *Məsafəni təyin etmək. İki kənd arasındakı məsafə. – Bazarla çalışdığımız yerin məsafəsi iki kilometrə qədər var idi.* S.S.Axundov. *Ancaq məsafə uzaq olduğundan Fərman onun üzünü seçə bilmirdi.* Ə.Sadıq.

**MƏSAFƏLİ** *sif.* Müəyyən məsafəsi olan; aralı.

**MƏSAFƏÖLÇƏN** *is. xüs.* Müşahidəçidən müşahidə olunan şeyə qədərki məsafəni bilavasitə ölçmədən müəyyən edən cihaz. *Optik məsafəölçən.*

**MƏSAMƏ** *is.* [*ər.*] 1. Dərinin üzərində tər vəzilərinin ən xırda deşiyi.

2. Maddənin hissəcikləri arasındakı boşluq, ara.

**MƏSAMƏLİ** *sif.* Məsamələri olan, kiçik deşikləri olan. *Məsaməli daş.*

**MƏSAMƏLİLİK** *is.* Məsaməli şeyin hal və xassəsi, məsaməli olma. *Süxurların məsaməliliyi.*

**MƏSARİF** *is.* [*ər.* "məsrəf" söz. cəmi] Xərc, xərc olunan miqdar; məsrəf. *Yol məsarifi. – Hər bir kəndli* [bəyin] *Tiflisdəki məsarifini bilir..* H.Nəzərli. "*Səadət*" *cəmiyyəti məsarifi öz öhdəsinə almaq istəyirdi.* Mir Cəlal.

**MƏSCİD** *is.* [*ər.*] Müsəlmanların ibadət evi; came. *Qoca müəzzin əlində bir arşın müştük məscidin önündə durmuşdu.* Çəmənzəminli.

**MƏSDƏR** *is.* [*ər.*] *qram.* Felin zaman, şəxs və kəmiyyət kateqoriyası olmayan qeyri-müəyyən forması.

**MƏSƏL** [*ər.*] b a x **zərbi-məsəl**. *Çün* "*uman yerdən küsərlər*" *bir məsəldir xəlq ara; Küsdüyüm bica deyildir, aşinadən küsmüşəm.* M.P.Vaqif. *Məsəl var ki, evli evində yatar; Bəs qərib neyləyər, harda axşamlar?* R.Rza.

**MƏSƏLA** [*ər.*] b a x **məsələn**.

**MƏSƏLÇİ** *is.* Danışarkən tez-tez məsəl çəkən, danışanda məsəl çəkməyi sevən adam.

**MƏSƏLƏ** *is.* [*ər.*] 1. Həll olunması, yerinə yetirilməsi lazım olan iş. *Təkcə müəllim məsələsi olsaydı, .. Rüstəm kişi qırx kilometr yolu keçib rayona getməzdi.* M.İbrahimov. [Qız] *vacib bir məsələ ardınca gedənlər kimi gedirdi.* Mir Cəlal. // Üzərində düşünülüb müzakirə və həllini tələb edən vəziyyət, hal, iş. *Məsələni müzakirə etmək. Aqrar məsələsi. Mübahisəli məsələ. – İki saat əvvəl başlanmış bu iclasda çox mühüm məsələlər müzakirə olunmuş(du).* Ə.Vəliyev. ☐ **Məsələ qaldırmaq** – bir iş və ya şey haqqında müzakirə açmaq. // Diqqət mərkəzində duran, müzakirə edilməli olan şey; iş; mətləb. *Əsas məsələyə keçmək.* // Zor iş, çətin iş. *Müdirin qəbuluna düşmək indi bir məsələ olub.*

2. Müəyyən şərtləri gözləməklə, verilən rəqəmlərə əsasən həll edilməsi tələb olunan riyazi sual. *Məsələnin cavabını tapmaq. Hesabdan məsələ həll etmək.*

3. Elmin hər hansı bir sahəsinə həsr olunmuş bəzi elmi jurnal və məcmuələrin adı (əsasən cəmdə işlənir). "*Dilçilik məsələləri*". "*Tarix məsələləri*".

**MƏSƏLƏN** *bağl.* [*ər.*] 1. Cümlədə bir şeyin şərhinə dair misallar vermək üçün işlədilir. *Əşyanın adını bildirən sözlərə isim deyilir, məsələn: quş, ev, adam və s.*

2. Cümlədə müəyyən fikri nəzərə çarpdırdıqda işlədilir. "*Tərcüman*"*ın fərmayişindən bu çıxır ki, məsələn, bütün Maku xanlığında tək bircə Murtuza Qulu xan qıldığı namaz dürüstdür..* C.Məmmədquluzadə.

**MƏSƏRRƏT** *is.* [*ər.*] *köhn.* Şadlıq, şənlik, sevinc.

**MƏSXƏRƏ** *is.* [*ər.*] 1. İstehza, ələ salma, masqara.

2. Hoqqabaz, oyunbaz, masqarabaz. *Səfheyi-*"*İqbal*" *dönüb dəftərə; Şeir yazır onda yetən məsxərə.* Ə.Qəmküsar.

**MƏSİHİ** *is.* [*ər.*] *klas.* 1. Xristian dini, xristianlıq, xaçpərəstlik.

2. Xristian dinində olan adam; xristian, xaçpərəst.

**MƏSKƏN** *is.* [*ər.*] 1. İnsanın yaşadığı yer, yurd; ev və s. [Şamama cadu:] *Özüm də bilmirəm haralıyam. Nə yerim var, nə məskənim.* Ə.Haqverdiyev. *Bir aydır ki, sevgilisinin məskəni olan kəndin qarşısında durur.* H.Nəzərli. ☐ **Məskən salmaq** – bir yerdə yaşamağa başlamaq, yurd, yurd-yuva salmaq. *Şəhərdə məskən salmaq.* – [Yolçu:] *Orada məskən salmaq fikrindəyəm.* Ə.Məmmədxanlı. *Heyvanlar özlərinə buralarda məskən salmağa başlamışdılar.* M.Rzaquluzadə.

2. Bir şeyin olduğu, yerləşdiyi yer. *Gərdəndə tellər nə gözəl teldi; Onların məskəni o nazik beldi.* M.P.Vaqif. *Qızğın alver məskəni olan Bazar küçəsi qoçuların gəlir yeri idi.* A.Şaiq. ☐ **Məskən etmək (eləmək)** – yerləşmək, özünə yurd etmək, yer tutmaq. *Zülfündə məskən eylədi cani Nəsiminin; Canın həmişə məskəni ol aşiyanədir.* Nəsimi. *Can quşu zülfündə məskən eyləmiş; Onunçün qorxuram mən şanələrdən..* Q.Zakir. **Məskən tutmaq** – b a x **məskən etmək**. *Ta ayağın tozu tək qapında məskən tutmuşam; Bu səadətdən mənim, baxdım ki, bəxtim tac alır.* Xətayi.

**MƏSKUN** *is.* [*ər.*] İnsan yaşayan, sakin olan yer, insanların oturduğu, yaşadığı yer. ☐ **Məskun etmək** – əhali yerləşdirmək, sakin etmək, oturtmaq. *Boş yerləri məskun*

*etmək.* **Məskun olmaq** – yerləşmək, sakin olmaq, yaşamaq (əhali).

**MƏSLƏHƏT** *is.* [*ər.*] 1. Necə hərəkət etmək, bir işi necə görmək haqqında təklif, göstəriş, tövsiyə. *Həkim məsləhəti. Məsləhət vermək.* – [Şah buyurdu ki:] *Sizi bir əmrdən ötrü məsləhətə çağırmışam, gərək haman xüsusda bir tədbir göstərəsiniz.* M.F.Axundzadə. [Ağca] *dünyagörmüş xanımların məsləhətilə bir dayə tutub, uşağı ona tapşırdı.* Mir Cəlal. □ **Məsləhət bilmək** – olmasını, edilməsini müvafiq görmək, tövsiyə etmək. *Həkimlər* [Səlimin] *yerində tərpənməyini, durub asta-asta, köməkçi ilə gəzməyini məsləhət bilirdilər*. S.Rəhimov. **Məsləhət deyil** – məsləhət görülmür, lazım deyil, tövsiyə edilmir. *..Bəlkə, heç Şeyxi narahat eləməyimiz məsləhət deyil?* C.Məmmədquluzadə. *Heç məsləhət deyil, əyləş, özünə bir-iki saatlığa bir məşğuliyyət tap.* Ə.Haqverdiyev. **Məsləhət etmək (eləmək)** – 1) b a x **məsləhət görmək**. *Düşəndə eylərlər sizə məsləhət; Xahi aşikarə, xahi də xəlvət.* Q.Zakir; 2) b a x **məsləhətləşmək** 2-ci mənada. *Noxudu bozbaşa salanda aşpazı qoyub, axund ilə məsləhət eləyirik*. C.Məmmədquluzadə. *Bilmək olmur nə məsləhət edirlər; Bəlkə basqın eyləməyə gedirlər?* A.Səhhət. **Məsləhət qoymaq** – məsləhətləşib qərara gəlmək. [Səriyyə:] *Bu gün anam, Həmzə və oğlanları məsləhət qoydular ki, məni Qurbana versinlər.* C.Cabbarlı. **Məsləhət vermək (görmək)** – necə hərəkət etmək, nə etmək haqqında birinə yol göstərmək, münasib bilmək, tədbir göstərmək, göstəriş vermək. *Məşədi Həsən uzaq getməyi məsləhət görmədi.* Ə.Haqverdiyev. [Almaz:] *Sən öz sağlam duyğunla mənə məsləhət ver*. C.Cabbarlı.

2. Hər hansı bir məsələyə dair mütəxəssisin tövsiyəsi, göstərişi; konsultasiya. *Məsləhət almaq. Məsləhət üçün mütəxəssisə müraciət etmək.* // Dərsi daha yaxşı mənimsəmək üçün müəllimin tələbəyə dərsdən əlavə köməyi, yardımı. *Məsləhət saatı təyin etmək. Məsləhət günü.*

**MƏSLƏHƏTÇİ** *is.* Öz ixtisası üzrə məsləhət verən adam. *Hüquq məsləhətçisi. Məsləhətçiyə müraciət etmək.*

**MƏSLƏHƏTXANA** *is.* [*ər.* məsləhət və *fars.* ...xanə] Müəyyən məsələ (hüquqi, tibbi və s.) haqqında mütəxəssislərin məsləhətləri ilə əhaliyə kömək göstərən idarə. *Hüquq məsləhətxanası. – Qadın və uşaq məsləhətxanalarının sayı ildən-ilə artır.*

**MƏSLƏHƏTLƏŞMƏ** "Məsləhətləşmək"-dən *f.is.*

**MƏSLƏHƏTLƏŞMƏK** *f.* 1. Necə hərəkət etmək, bir şeyi necə görmək haqqında biri ilə məsləhət etmək, onun rəyini soruşmaq, məsləhət almaq üçün müraciət etmək. *Atası ilə məsləhətləşmək.* – [Mehriban] *istəyirdi ki, Zeynal barəsində onunla danışıb məsləhətləşsin.* S.Hüseyn. [Qarı:] *Mən gözləyirəm, get məsləhətləş, iki ağıl bir ağıldan üstün olar.* S.Rəhman.

2. *qarş.* Bir yerdə fikir mübadiləsi aparmaq, məşvərət etmək. *Bir müddət keçdi, doktorlar yığışıb məsləhətləşdilər.* S.Rəhimov. *Serjant cəld çıxıb camaatla məsləhətləşdi və iki nəfərlə içəri girdi.* H.Seyidbəyli.

**MƏSLƏHƏTLİ** *sif.* Məsləhət ilə görülən, məsləhət ilə olan. *Məsləhətli don gen olar*. (Ata. sözü).

**MƏSLƏK** *is.* [*ər.*] 1. Hər hansı bir dünyagörüşünə əsaslanan əqidə, məfkurə, amal. *Məsləkim, şüarım ucadan uca; Mən getdim, yoldaşlar, gəlin arxamca!* A.Şaiq.

2. Etiqad, məzhəb, inam. [Şeyx Sənan:] *Kimsiniz? Məsləkü təriqətiniz; Nə imiş? Söyləyin, rica edəriz.* H.Cavid. □ **Məslək(imiz) haqqı** – andiçmə məqamında işlədilir. [Musanın nəvəsi] *artıq hər dəfə and içəndə daha "məsləkim haqqı" deməyirdi*. Qantəmir. [Yarməmməd:] *Məsləkimiz haqqı, mən şəxsi tənqidi sevirəm*. M.İbrahimov. // *köhn.* Hər bir şəxsin özü üçün seçmiş olduğu yol, xətti-hərəkət, istiqamət.

3. İstək, arzu, dilək mənasında. *Könlümdə gül, çiçək açdı; Bir məsləkim, min diləyim*. S.Rüstəm.

**MƏSLƏKBAZ** *is.* [*ər.* məslək və *fars.* ...baz] Tez-tez məslək dəyişən adam.

**MƏSLƏKBAZLIQ** *is.* Tez-tez məslək dəyişmə.

**MƏSLƏKDAŞ** *is.* Bir məsləkdə olanlardan hər biri; həmməslək, məsləkcə yoldaş, bir-

məsləkli. *Bir-birimizlə yoldaş, məsləkdaş olaq!..* S.Hüseyn. *Kərim öz dostuna, məsləkdaşına; Yaxşılıq istədi, yamanlıq oldu*. B.Vahabzadə.

**MƏSLƏKDAŞLIQ** *is.* Eyni məsləkdə olma; həmməsləklik, birməsləklilik.

**MƏSLƏKLİ** *sif.* Müəyyən məsləkli olan; möhkəm etiqadlı, əqidəli, amallı. *Məsləkli adam. – Ağa Əli tərəqqipərvər iranlıların ən qeyrətli, ən məsləkli cavanlarından idi.* Çəmənzəminli.

**MƏSLƏKLİLİK** *is.* Məsləkli olma; etiqadlılıq, əqidəlilik.

**MƏSLƏKSİZ** *sif.* Heç bir məsləki olmayan; etiqadsız, əqidəsiz, amalsız, prinsipsiz. *Məsləksiz adam. – Vətən! Qoynunda bəslənmiş əməllər, arzular şəksiz; Vətənsiz, yurdsuz insanlar yaşar aləmdə məsləksiz.* S.Vurğun.

**MƏSLƏKSİZLİK** *is.* Məsləksiz olma; etiqadsızlıq, əqidəsizlik, prinsipsizlik, amalsızlıq. *O özünü məsləksizliyi üstündə qınamırdı, bacarıqsız olduğu üçün qınayırdı.* Ə.Əbülhəsən.

**MƏSMƏSİ** *is. bot.* Üzəri sadə və ya budaqlı tüklərlə örtülü birillik bitki.

**MƏSNƏVİ** *is.* [*ər.*] *ədəb.* Hər iki misrası həmqafiyə olan böyük şeir, mənzumə. *Cəlaləddin Ruminin məsnəviləri. – Gah məsnəviyə olub həvəsnak; Ol bəhrdə istərəm düripak.* Füzuli.

**MƏSRƏF** *is.* [*ər.*] 1. Xərclənən pul, işlənən şey; xərc. *Yol məsrəfi. Evin aylıq məsrəfi.* ☐ **Məsrəf etmək (eləmək)** – xərcləmək, işlətmək, sərf etmək. [Tükəz:] *..Öz malını nə özün yeyib-içirsən, nə əyalına məsrəf edirsən.* M.F.Axundzadə. [Hacı:] *..Özüm fəqirlərə məsrəf elədiyimdən əlavə, iyirmicə manat müamilə qoyub, o müamiləni də fəqirlərə verirəm.* Ə.Haqverdiyev. **Məsrəf olmaq** – xərclənmək, işlənmək.

2. Sərfə, xeyir, fayda. *Nə məsrəfi var bizlərə, meyxanə dağılsın*. Heyran xanım. [Hacı Nuru:] *..Bu surətdə mənim hünərimdən nə fayda olacaq, mənim şerim nəyə məsrəfdir.* M.F.Axundzadə.

3. Sərf olunma, işlənmə. *Suyun məsrəfinə diqqət vermək. Əmək məsrəfini azaltmaq.* ☐ **Məsrəf olmaq** – sərf olunmaq, xərclənmək, işlənmək. [Məhərrəm bəy:] *Bəli, bir çox izafə xərclər aramızda adət olunmuşdur. Məsələn: toy işində, vay işində məsrəf olan xərclər kimi.* S.S.Axundov.

◊ **Məsrəfdən çıxmaq (düşmək)** – sıradan çıxmaq, daha yaramamaq, əldən düşmək, daha istifadə edilə bilməmək. *Ayaqqabım məsrəfdən düşüb*. – [Əvvəlinci ərizəçi:] *İndi at məsrəfdən çıxıbdır.* M.F.Axundzadə.

**MƏSRƏFLİ** *sif.* 1. Sərf olunan, məsrəf olunan.

2. *məc. dan.* Faydalı, ağıllı-başlı. *Mən də deyirəm, bəs kişinin qızı ağzını açıb məsrəfli bir söz söyləyəcək*. Ə.Vəliyev.

**MƏSRUR** *sif.* [*ər.*] Şən, şad, şadman, sevincli. *Sakit küçələr* [Midhədə] *geniş göründü, .. şəhər hürr və məsrur idi*. Çəmənzəminli. *Əbdül Saranın otağına daxil olub su səpir, yelləyir, fəqət üzü məsrurdur*. C.Cabbarlı. // Zərf mənasında. [Rzaquluxan:] *Sənin bu dillərin .. məni çox məsrur yola salır*. M.S.Ordubadi. *Sən fəqət qalib olan ordunla; Cəbhələrdə dolaşırsan məsrur.* A.Şaiq. **Məsrur etmək** – 1) sevindirmək, şadlandırmaq, şad etmək; 2) xoşbəxt etmək, məramına, istəyinə çatdırmaq. **Məsrur olmaq** – şad olmaq, sevinmək, şadlanmaq. *Olmadın məsrur, ta mən zarü-giryan olmadım; Xatirin cəm olmadı, ta mən pərişan olmadım.* Qövsi. [Şeyx Sənan:] *Gəldi bir şeyx o dəm üzündə niqab; Məni ta gördü, oldu pak məsrur.* H.Cavid.

**MƏSRURİYYƏT** *is.* [*ər.*] *klas.* Məsrurluq, şadlıq, sevinc. *Hamı əyləşib yenidən məsruriyyət ilə dinlərdilər.* Ə.Haqverdiyev.

**MƏST**[1] *sif.* [*fars.*] 1. Sərxoş, kefli. *Ya balıq tutandır, tufana tutulmuş; Yaxud məst imiş kim, batmış və boğulmuş.* A.Səhhət. ☐ **Məst etmək (eləmək)** – kefləndirmək, sərxoş etmək. *İçki onu məst etdi*. **Məst olmaq** – içib keflənmək, sərxoş olmaq. *Axır vaxtlarda Yusif .. əlinə düşən pulu içkiyə verib tez-tez məst olurdu*. S.S.Axundov. [Ağa Mərdan bəy] *.. məst olaraq arvadı evdən çıxarıb .. balkonda yatmağa məcbur edərdi.* T.Ş.Simurq.

2. *məc.* Xoş və gözəl bir təəssüratdan təsirlənmiş, nəşələnmiş, keflənən kimi olmuş, bihuş olmuş, məftun olmuş. *Mən nəşeyiləli-ləbi-canan ilə məstəm; Saqi, mənə minbəd meyi-nab gərəkməz*. M.Ə.Sabir. ☐ **Məst**

**etmək (eləmək)** *məc.* – kefləndirmək, nəşələndirmək, bihuş etmək, məftun etmək. *Onu məst edərdi öz gözəlliyi; Gül-çiçək açardı gözündə hər yan.* B.Vahabzadə. *Peçin üstündə qazançadan qalxan qızartma iyi Gülyazı məst elədi.* Q.İlkin. **Məst olmaq** *məc.* – gözəl bir şeyin təsirindən keflənmiş kimi olmaq, huşu getmək, məftun olmaq. *Yüzün gördü, şeyda könül, məst oldu; Nə hacət ki, həşr olduqca ayinə.* M.V.Vidadi. *Səhər yerindən qalxıb həyətə çıxanda ətirdən məst olursan.* Mir Cəlal.

**MƏST**[2] *is.* [*fars.* məs] Dəridən və ya başqa yumşaq materialdan tikilən yüngül ayaqqabı; məs. *Məst geymək.* – [Qərib:] *Birisinin ayağında məsti var; Birisinin can almağa qəsdi var.* "Aşıq Qərib". *Qərənfil bacının .. ayaqlarında ipək corabla yüngül məst var idi.* İ.Əfəndiyev.

**MƏSTAN** [*fars.*] 1. *sif.* Axıcı, süzgün, xumar (göz haqqında). *Gözləri məstan, sürahi tək çəkilmiş gərdəni; Sözü şirin, özü amma xosrovi-əla pəri.* M.P.Vaqif. *Endirmədi aşığına; O gözləri məstan keçdi.* Aşıq Ələsgər.

2. *is.* Pişik, pişiyə qoyulan ad. *Uşaq məstan ilə oynayır. – Qayıdıb bir baxdı məstanə; Gördü eşşək gəlir dilirانə.* A.Səhhət. *Mənim məstan pişiyim, yenə çıxıb dizimə; O yaşıl gözlərini zilləmisən üzümə.* R.Rza.

**MƏSTANƏ** *sif.* Süzgün, axıcı, xumar. *Apardı ağlımı, din-imanımı; Sənin belə bu məstanə gözlərin.* M.P.Vaqif. *O məstanə gözlər süzüldükcə hər an; Alar can, tökər qan xuraman-xuraman.* H.Cavid.

**MƏSTEDİCİ** *sif.* Kefləndirən, xumarlandıran, bihuş edən, bihuşedici. [Dilbərgilin] *həyətlərindəki yasəmən, ərik, alça, albalı ağaclarının çiçəkləri ətrafa məstedici bir qoxu saçırdı.* Ə.Sadıq. *..Səhər nəsimi .. gül və çiçəklərin məstedici rayihəsini ətrafa yayırdı.* M.Dilbazi.

**MƏSTEDİCİLİK** *is.* Məstedici şeyin xassəsi, təsiri.

**MƏSTLİK** *is.* Məst olma, keflənmə, sərxoş olma; keflilik, sərxoşluq. *Məstlikdən ayılmaq. – Məstlikdir kim, qılır qəm əhlinə qəmxarlıq.* Füzuli. [Nadir] *dərhal məstliyindən ayıldı və qanrılıb baxdıqda Məstan bizi gördü.* B.Talıblı.

**MƏSUD** *sif.* və *zərf* [*ər.*] Xoşbəxt, bəxtiyar, səadətli. *Məsud adam. Məsud yaşamaq.* – [Maral:] *Məsud bir göyərçin kimi saf və azadə yaşayırdım..* H.Cavid. *Hər üfüqdə bir həvəs, hər bucaqda bir umud; İnsanlar daha məsud.* M.Müşfiq. ☐ **Məsud olmaq** – xoşbəxt olmaq, bəxtiyar olmaq, səadət içərisində yaşamaq. [Balaş:] *..Gəlişinizdən nə qədər məmnun olduğumu bilsəydiniz, məsud olardım.* C.Cabbarlı.

**MƏSUL** *sif.* [*ər.*] 1. Üzərinə məsuliyyət qoyulan, cavabdeh olan; cavabdeh, cavabdehəndə, sorğulu. *Mirzağa* [Cəmiləni] *istirahət evinin bir xidmətçisi və ya məsul bir işçisi zənn etdi.* S.Hüseyn. *Qəza komitəsinin məsul katibi Nəimovla Cəmil ilk dəfə görüşdü.* Mir Cəlal. ☐ **Məsul olmaq** – cavabdeh olmaq, üzərində məsuliyyət olmaq. *O, bu işə məsul olmaq istəmir.*

2. Böyük əhəmiyyəti olan, çox mühüm, çox əhəmiyyətli; məsuliyyətli. *O, bu çətin və məsul vəzifənin öhdəsindən istedadla gəlməkdə idi.* Ə.Məmmədxanlı. *Onlar belə bir məsul işə getdikləri üçün qürurlanırdılar.* İ.Əfəndiyev.

**MƏSULİYYƏT** *is.* [*ər.*] Məsul olma, cavabdehlik. [Möhsünzadə] *ona başqa bir şöbədə adi və məsuliyyəti az bir vəzifə təklif edirdi.* S.Hüseyn. ☐ **Məsuliyyət daşımaq** – cavabdeh olmaq. // Öz hərəkətindən, işindən doğa biləcək hər hansı pis nəticəni nəzərə alıb ona cavabdeh olma, məsul olma; cavabdehlik. [Balaş:] *Dilbər, sən bilirsən ki, o biri kağız üçün iş hələ də məhkəmədədir. İndi də bunun məsuliyyəti!* C.Cabbarlı. [Həkim:] *Xəstənin azarı ağır olanda həkimin məsuliyyəti daha da artır.* Ə.Vəliyev.

◊ **Məsuliyyətə almaq** – məhkəməyə vermək, məhkəmə məsuliyyətinə cəlb etmək. *Cinayətkarı məsuliyyətə almaq.* – [Sədr:] *Müqəssirlər məsuliyyətə alınırlar.* C.Cabbarlı. [Prokuror:] *Hər bir iş üstündə adamı ləkələmək, məsuliyyətə almaq olmaz.* S.Rəhimov.

**MƏSULİYYƏTLİ** *sif.* Məsuliyyəti olan; məsul. *Məsuliyyətli tapşırıq.* // *məc.* Çox mühüm, çox əhəmiyyətli. *Tikintidə ekskavatorçulara çox çətin və məsuliyyətli bir iş tapşırılmışdı.* Ə.Sadıq.

**MƏSULİYYƏTSİZ** *sif.* 1. Məsuliyyəti olmayan, cavabdehliyi olmayan.

2. Məsuliyyət hiss etməyən, öz hərəkətlərinə fikir verməyən, cavabdehlik bilməyən. *Məsuliyyətsiz adam. Məsuliyyətsiz cavab.*

**MƏSULİYYƏTSİZCƏSİNƏ** *zərf* Heç bir məsuliyyət hiss etməyərək, özünü məsul bilməyərək. *İşə məsuliyyətsizcəsinə yanaşmaq.*

**MƏSULİYYƏTSİZLİK** *is.* Məsuliyyətin olmadığı hal. [Şeyda:] *Sınaq adlandırmaqla məsuliyyətsizliyin üstünü örtmək fikrinə düşməyin*. B.Bayramov.

**MƏSULLUQ** b a x **məsuliyyət**. *Divanəlik asarıdır, məsulluqdan azaddır*. A.Səhhət.

**MƏSUM** *sif.* [*ər.*] Günahsız; heç bir günahı, qəbahəti olmayan. // "Yazıq, zavallı" mənasında. *Məsum uşaqların naləsi, məzlum anaların fəryadı göylərə səda salmışdı.* S.S.Axundov. *Gözümün qarşısında mələk qədər məsum bir vücud od içində yanır.* S.Hüseyn. *Bu kiçik məsum heyvanları dəlicəsinə sevərdim*. A.Şaiq.

**məsum-məsum** *zərf* b a x **məsumcasına**. *Gövhər də məsum-məsum* [Qəhrəmanın] *üzünə tamaşa edirdi.* Ə.Vəliyev.

**MƏSUMANƏ** *sif.* [*ər.* məsum və *fars.* ...anə] Günahsız, heç bir günah və təqsiri olmayan; məsumcasına. *Məsumanə baxış. – Nə küskün bir nəzər, yarəb? Nə məsumanə bir surət!* H.Cavid.

**MƏSUMCASINA** *zərf* Günahsızcasına, məsumanə, məsum-məsum. *Məsumcasına baxmaq.*

**MƏSUMLUQ** *is.* 1. Təmizlik, paklıq, saflıq. [Fuad:] *Sən anla ki, bir ailənin səadəti ondakı qadının məsumluğundadır.* C.Cabbarlı. [Fərmanın] *üzünün ifadələrində bir uşaq sadəliyi və məsumluğu nəzərə çarpırdı*. Ə.Sadıq.

2. Yazıqlıq, fağırlıq, günahsızlıq. [Şiraslanın] *üz-gözündən bir məsumluq, bir mükəddərlik yağırdı.* S.Rəhimov.

**MƏŞƏDİ** *is.* [İranda Xorasan – Məşhəd şəhərinin adından] *din*. Keçmişdə Məşhədə gedib "müqəddəs" yerləri ziyarət edən adama verilən ad (çox vaxt adın qabağında gətirilərək deyilir). [Hambal:] *Məşədi, deyəsən, qızın iki namizədi var?* Ü.Hacıbəyov. *..Mahud çuxalı məşədi küləyin qabağında yumağa dönüb aradan çıxdı*. S.Rəhimov.

**MƏŞƏQQƏT** [*ər.*] 1. *is.* Əzab, əziyyət, sıxıntı, zəhmət, möhnət. *Gözlərindən və üzündən* [dərvişin] *yuxu və məşəqqət görünürdü*. A.Divanbəyoğlu. *Qurtarmışdı qışın sərt məşəqqəti; Açırdı ürəyi yazın ləzzəti*. H.K.Sanılı. □ **Məşəqqət çəkmək** – əzab çəkmək, əziyyət çəkmək, sıxıntı çəkmək, möhnət çəkmək. *Qıldın məni çünki sirrə məhrəm; Dur, çəkmə dəxi məşəqqətü qəm.* Məsihi. *Züleyxa çəkdiyi məşəqqətlərdən cana gəlib öz qardaşının evinə pənah gətirdi.* C.Cabbarlı.

2. **Məşəqqətlə** şəklində *zərf* – əziyyətlə, zəhmətlə, zorla. *Biçarə qolunun ağrısından bitab düşüb nəhayət məşəqqətlə özünü sınıqçı Kərbəlayı Piriyə yetirdi.* S.M.Qənizadə.

**MƏŞƏQQƏTLİ** *sif.* Çox ağır, çox zəhmətli, çox əzablı, əziyyətli, sərt. *Əcnəbi müsafir Bakının məşəqqətli rüzgarına adət etmədiyindən, Məşədi Əsgərin ardınca ahəstə-ahəstə gedirdi.* S.M.Qənizadə. *Qışın soyuq, məşəqqətli bir gecəsi idi.* C.Cabbarlı.

**MƏŞƏL** *is.* [*ər.*] 1. Ətrafı işıqlandırmaq üçün ağac və s. başına sarınaraq, yaxud xüsusi bir alət içərisinə qoyularaq yandırılan yağlı (neftli) əsgi, cındır parçası, yaxud ağac başına keçirilmiş içində yanar maddə olan qab. *Məşəl yandırmaq. – Toyxananın qapısında məşəl yandırardılar.* H.Sarabski. *İki uşaq əlağacının başına əsgi sarımaqla düzəltdikləri məşəlləri yaxına gətirdilər.* Ə.Əbülhəsən. // *məc*. İnqilab və ya vətənin azadlığı uğrunda həlak olmuş şəxslərin xatirəsini əbədiləşdirmək üçün onların qəbirləri üstündə və ya başqa yerdə daim yanan od, alov.

2. *məc.* Yol göstərən; mayak. *Sən çox yaşa, ey nazlı Vətən, çox yaşa, yüksəl! Parla, gələcək Şərq üçün ol ayinə, məşəl!* Ə.Nəzmi.

**MƏŞƏLLƏNMƏK** *f.* Parıldamaq, işıq vermək, işıqlanmaq, işıldamaq. [Dərvişin] *gözləri məşəlləndi.* A.Divanbəyoğlu.

**MƏŞƏLLİ** *sif.* Əlində məşəl olan, əlinə məşəl götürmüş. [Quldurbaşı] *Uruz əli məşəlli iki keşikçi ilə qazmaya yönəldi.* M.Rzaquluzadə.

**MƏŞĞƏLƏ** *is.* [*ər.*] 1. Bir şeyi bir yerə yığışaraq öyrənmə, öyrənməklə məşğul olma. *Dərnəyin məşğələsi. – Rəsmiyyətə görə*

*məşğələ hələ bir saat bundan qabaq bitmişdi.* S.Rəhimov. *Savad kursunun növbəti məşğələlərindən biri idi.* Ə.Vəliyev.

2. Məşq. *İdman məşğələsi. Orkestr məşğələ keçir.*

3. Vaxt keçirmə, bir şeylə məşğul olma; məşğuliyyət. *Bu məşğələnin mənim üçün böyük ləzzəti var.* C.Məmmədquluzadə.

**MƏŞĞUL** *is.* [*ər.*] Bir iş görən, bir işdə çalışan, iş görməkdə olan, bir işlə başı qarışıq olan. *Müdir məşğuldur, qəbul edə bilməz. – Nənəxanım Yetərlə söhbətə məşğul idi.* Çəmənzəminli. [Sona Ümidə:] *Görünür, çox ciddi məşğulsunuz..* B.Bayramov. ☐ **Məşğul etmək** – 1) başını qarışdırmaq, əyləndirmək. *Yaşı otuzdan yuxarı olmasına baxmayaraq*, [qadın] *Zeynalı məşğul edə bilirdi*. S.Hüseyn. *Həbibin söhbəti Salamı məşğul edə bilmədi*. Mir Cəlal; 2) fikrini yayındırıb işinə mane olmaq, vaxtını almaq, işindən ayırmaq. **Məşğul olmaq** – 1) bir sənəti olmaq, bir peşə sahibi olmaq, bir işdə işləmək. *Müəllimliklə məşğul olur. Saatsazlıqla məşğul olmaq.* – [Ümid katibə:] *Mənim nə işlə məşğul olduğumla maraqlanırsınızsa, gedib öz gözünüzlə görə bilərsiniz.* B.Bayramov; 2) bir iş görmək, başı qarışmaq, çalışmaq. *Mütaliə ilə məşğul olmaq*. – [Rəhim] *bəylə ikimiz bir kənarda, otun üzərinə salınmış cecim üstündə əyləşib söhbətə məşğul olduq*. Ə.Haqverdiyev. *Dərviş cavab verməyib, çörək yeməyə yenə dəxi məşğul oldu.* A.Divanbəyoğlu; 3) fikir vermək, maraq göstərmək. *Uşaqları ilə məşğul olmaq. Ata-anası onunla yaxşı məşğul olmamışdır;* 4) özünə, öz səhhətinə, canına, üst-başına və s. baxmaq, qeydinə qalmaq. *Sən heç özünlə məşğul olmursan.*

**MƏŞĞULİYYƏT** *is.* [*ər.*] 1. Bax **məşğələ** 1-ci mənada. *Məşğuliyyət bitdi.*

2. Əyləncə, vaxt keçirmək üçün olan iş, oyun, əyləncə və s. *Axşamlar hər məhəllənin qonşuları qum üstünə yığışıb məşğuliyyət üçün növbənöv oyun oynardılar.* H.Sarabski. *İlin hər fəslində biz uşaqlar üçün bağda məşğuliyyət var idi.* S.S.Axundov.

**MƏŞĞULİ-ZİMMƏ** *is.* [*ər.*]: **məşğuli-zimmə olmaq** *köhn. dan.* – birinin pulunu və ya malını mənimsəməklə, yaxud biri haqqında düzgün olmayan fikir söyləməklə günaha batmaq, özünü onun qarşısında borclu hiss etmək. *Mən bu barədə danışmasam məşğuli-zimmə olaram.* Ə.Haqverdiyev.

**MƏŞHUR** *sif.* [*ər.*] 1. Şöhrət qazanmış, adlı-sanlı, şöhrətli, tanınmış. *Məşhur alim. Məşhur idmançı. – Divara bir neçə məşhur artistin portreti vurulmuşdu.* İ.Əfəndiyev. ☐ **Məşhur etmək** – ad qazandırmaq, şöhrətləndirmək. **Məşhur olmaq** – ad-san qazanmaq, şöhrətlənmək, məşhurlaşmaq.

2. Hamıya məlum olan, çoxunun bildiyi, məlum. *Bu məşhur bir məsəldir, Seyyida,* "*qaz vur, qazan doldur!*" S.Ə.Şirvani. *Məşhur Binəqədi gölündən, yəqin ki, xəbəriniz var.* M.Rzaquluzadə. ☐ **Məşhur etmək (qılmaq)** – tanıtmaq, hamıya bildirmək, məlum etmək. *Məşhur qıldı eşqi-Züleyxa o Yusifi; Aşiqdə hüsn şöhrətinə ictihad olur*. S.Ə.Şirvani. **Məşhur olmaq** – tanınmaq, hamıya məlum olmaq.

◊ **Qələti-məşhur** – yanlış olduğu halda xalq arasında işlənilən söz və ya ifadə.

**MƏŞHURLANMA** "Məşhurlanmaq"dan *f.is.*

**MƏŞHURLANMAQ** bax **məşhurlaşmaq**.

**MƏŞHURLAŞDIRILMA** "Məşhurlaşdırılmaq"dan *f.is.*

**MƏŞHURLAŞDIRILMAQ** *məch.* Məşhur edilmək, hamıya tanıtdırılmaq, şöhrətləndirilmək.

**MƏŞHURLAŞDIRMA** "Məşhurlaşdırmaq"dan *f.is.*

**MƏŞHURLAŞDIRMAQ** *f.* Məşhur etmək, ad qazandırmaq, şöhrətləndirmək.

**MƏŞHURLAŞMA** "Məşhurlaşmaq"dan *f.is.*

**MƏŞHURLAŞMAQ** *f.* Məşhur olmaq, xalq arasında tanınmaq, ad-san qazanmaq. [Nəbi] *öz zirəklik və qoçaqlığı ilə Şuşa qalasında məşhurlaşır*. "Qaçaq Nəbi".

**MƏŞHURLUQ** *is.* Məşhur olma, xalq arasında tanınma, ad-sanlılıq, şöhrətlilik.

**MƏŞQ** *is.* [*ər.*] Bir şeyə alışmaq, öyrəşmək üçün edilən sistematik səy, təlim, hazırlıq. *İdman məşqi. Musiqi məşqi. Hərbi məşq.* – [Xurşid:] *Sən məşqi başla, mən bu saat gəlirəm*. C.Cabbarlı. *..Lətif müntəzəm olaraq Qara müəllimlə ayrılıqda məşq etməyə başladı.* H.Seyidbəyli. // Yazı təmrini.

**MƏŞQÇİ** *is. idm.* Məşqə rəhbərlik edən, məşq mütəxəssisi olan idmançı. *Futbol komandasının məşqçisi. Məşqçinin göstərişi.*

**MƏŞRİQ** *is.* [*ər.*] Günəşin doğduğu tərəf, şərq (*məğrib* əksi). // Günbatana (qərbə) müqabil olan tərəf. *Yusif Sərracın dükanı şah məscidinin meydanının məşriq səmtində idi.* M.F.Axundzadə. *İndi gurultu məğribdən məşriqə keçdi.* A.Divanbəyoğlu.

**MƏŞRUBAT** *top.* [*ər.* "məşrub" söz. cəmi] İçilən şeylər, içkilər (şərab, şərbət və s.). *Nökər Səfi stolun üstünə boşqablar və ənva məşrubat düzür.* Ə.Haqverdiyev. *Ortalıqda müzəyyən xonçalarda əlvan şirniyyat və sair Şərq adətincə ləvazimat, məşrubat, həlviyyat* [düzülmüşdü]. M.S.Ordubadi.

**MƏŞRUT** *sif.* [*ər.*] Bir şərtlə bağlı, şərt qoyulmuş, şərtli, qabaqcadan şərtləşdirilmiş, şərti. [Beyrək] *zamanın yetişdiyini görüb yumruğunu masaya çırpdı və ayağa qalxıb məşrut hərəkət işarəsini verdi.* M.Rzaquluzadə. // Varlığı digər bir şeyin və ya bir halın varlığından asılı olan, bağlı olan.

**MƏŞRUTƏ** *is.* [*ər.*] 1. *tar.* Mütləq hakimin, hökmdarın hüququnu məhdudlaşdıran konstitusiya (İranda və Türkiyədə). *Qıl nəzər məşrutəyə, hürriyyətə; Aləmə, alimliyə, ünsiyyətə.* Ə.Nəzmi. *Həmin o məşrutə istəyən budu? Məmmədəli şaha sataşan budu?* Mir Cəlal.

2. Konstitusiyalı dövlət quruluşu (İranda və Türkiyədə).

**MƏŞRUTƏÇİ** *is. tar.* Məşrutəli hökumət tərəfdarı, konstitusiya tərəfdarı; konstitusiyaçı. [Rəhim xan:] *Görmürsənmi neçə gündür padşahın əmri ilə məşrutəçiləri qırırlar?* C.Cabbarlı.

**MƏŞRUTƏÇİLİK** *is. tar.* Padşahın hakimiyyəti məşrutə (konstitusiya) ilə məhdudlaşdırılmış olan dövlət quruluşu.

**MƏŞRUTƏXAH** *is.* [*ər.* məşrut və *fars.* ...xah] *köhn.* b a x **məşrutəçi**. *Sultanın hökmü ilə zindanlarda çürüyən minlərlə məşrutəxahların ahü naləsi Kəlküttəyə çata bilməyib.* C.Məmmədquluzadə. [Atabəy:] *Əlahəzrətihümayun .. özünü bir məşrutəxah padşah kimi aparır.* P.Makulu.

**MƏŞRUTƏXAHLIQ** b a x **məşrutəçilik**.

**MƏŞRUTƏLİ** *sif.* Konstitusiyalı, konstitusiyaya əsaslanan. *Məşrutəli padşahlıq.*

**MƏŞRUTİYYƏT** b a x **məşrutəçilik**. *Osmanlıya gəldikdə, burada dəxi məşrutiyyət verilir ki, bu dəxi heç kəsin yuxusuna gəlməz bir vaqiə idi.* F.Köçərli. [Şeyx Məhəmməd:] *Biz deyirik ki, ölkəmizdə həqiqi bir məşrutiyyət hökmfərma olmalı, şəxsi nüfuz və imtiyazlar ləğv edilməlidir.* M.İbrahimov.

**MƏŞŞATƏ** [*ər.*] b a x **bəzəkçi** 2-ci mənada. *Məşşatə gözünə sürmə çəkəndə; Sanasan, gözümə bıçağı çəkər.* Q.Zakir. *Məşşatə, Tellinin anası ilə nə isə danışdı, sonra çıxdı.* Çəmənzəminli. *Məşədi İslamın yaxın adamı Mələknisə bu toyda məşşatə idi.* Mir Cəlal.

**MƏŞŞATƏLİK** *is.* Məşşatənin işi, peşəsi; bəzəkçilik. *Bu arvadın sənəti məşşatəlik idi.* Çəmənzəminli.

**MƏŞUQ** *sif.* [*ər.*] Sevilən, istənilən, məhəbbət yetirilən; sevgili, istəkli (kişi). *Sitarə ilk dəfə dünyaya həqiqət nəzərilə baxdı: cavan qızın qabağında xəyali məşuqu əvəzində doğruçu əri durmuşdu.* Çəmənzəminli. [Dərviş:] *Ruqiyyə gəlib, bir az ocağın qırağında oturub könlünü yəqin öz məşuqinə verdi.* A.Divanbəyoğlu.

**MƏŞUQƏ** *is.* Sevilən, sevgili (qadın), məhbubə. *Aşiq ilə məşuqə çox illər ayrı düşəndən sonra görüşüb öpüşürlər.* C.Məmmədquluzadə.

**MƏŞUQƏBAZ** [*ər.* məşuqə və *fars.* ...baz] *köhn.* b a x **aşnabaz**. *Sənə layiq deyil, Seyyid, dəxi məşuqəbaz olmaq.* S.Ə.Şirvani.

**MƏŞUQƏBAZLIQ** b a x **aşnabazlıq** 2-ci və 3-cü mənalarda.

**MƏŞUM** *sif.* [*ər.*] Uğursuz, nəhs, bədbəxt adamda qorxu, dəhşət hissi oyadan. [Maral:] *..İki sənə əvvəl böylə məşum qara günü kim xatırlardı?* H.Cavid. *Xanın bu məşum sükutu ən acı xəbərdən də ağır idi.* M.Rzaquluzadə. // Bədbəxt, talesiz. *Bitərbiyəliklə tifli-məsum; Axırda olur səfilü məşum.* M.Ə.Sabir.

**MƏŞUMLUQ** *is.* Uğursuzluq, nəhslik. // Bədbəxtlik, talesizlik.

**MƏŞVƏRƏT** *is.* [*ər.*] Bir məsələni həll etmək üçün yığışıb danışma, müzakirə etmə, məsləhətləşmə. [Paşa və onun adamları] *məclis açıb başladılar məşvərətə.* "Koroğlu". [Cəmaləddin:] *İndi, yoldaşlar, məşvərət vaxtı*

*keçmiş, qəti fikirlər və dəyərli işlər görmək lazımdır.* C.Cabbarlı. □ **Məşvərət etmək (eləmək)** – birlikdə müzakirə etmək, məsləhətləşmək. *Cəm oluban eylədilər məşvərət.* S.Ə.Şirvani. [Hadi lələ:] *..Bu saat Əmiraslan ağa Nadir bəygildə bəylərlə birlikdə məşvərət edir.* S.S.Axundov. // Məsləhət, gənəşmə. [Rəşid:] *Bibi və ana məsləhət və məşvərətdən sonra Fərəcin .. böyük qızını almağa qərar verdilər.* T.Ş.Simurq.

**MƏŞVƏRƏTÇİ** 1. *is.* Məsləhətçi, məsləhət verən. [Sərdar Zaman:] *O, dostlarını hələlik məşvərətçi sifətilə öz yanında saxlamış*(*dır*).. A.Şaiq.

2. *sif.* Hər hansı bir məsələ haqqında fikir söyləyə bilən, lakin qərar çıxarmaq hüququ olmayan. *Məşvərətçi iclas. Məşvərətçi səs.*

**MƏT** *is.* 1. Qaynadılıb suyu çəkilmiş qatı şirə. *Meyvə məti.*

2. Doşab, mürəbbə və s. bişirilən zaman əmələ bələn köpüyə oxşar şirə. Doşabın mətini yığmaq.

**MƏTA** *is.* [*ər.*] 1. Satılan mal, ticarət malı, alınıb-satılan şey; əmtəə, mal. *Yusif bazarıdır, hər kəsin mətaı varsa gətirsin.* (Ata. sözü). *..Bazar-dükanda əlavə heç bir məta yoxdur..* C.Məmmədquluzadə. [Tacir:] *Hanı mətaın? Malını göstər!* Ə.Məmmədxanlı.

2. Qiymətli şey, aztapılan şey. *Mətaın məta olunca, bazarın bazar olsun.* (Ata. sözü). // Ümumiyyətlə hər hansı bir şey. [Azad, Məryəm, Ziba] *deyərdilər, gülərdilər, hərənin nə mətaı olsa idi, ortalığa qoyardı.* Çəmənzəminli.

**MƏTANƏT** *is.* [*ər.*] Dözüm, davamlılıq, möhkəmlilik, yenilməzlik, sarsılmazlıq, səbat, mətinlik; iradə. *Firuz bütün mətanəti və səbatına rəğmən dəniz sahilindəki qayalardan birinin arxasına düşdü.* H.Nəzərli. *Xalq böyük bir mətanət və iradə ilə bu şərəfli mübarizəni başa çatdırdı.* M.İbrahimov.

**MƏTANƏTLİ** *sif.* Mətanəti olan, möhkəm iradəli; sarsılmaz, yenilməz, dözümlü, davamlı, mətin. *Mətanətli adam. – Bu gözəl, mətanətli, vüqarlı və qəhrəmanlara məxsus qəlbə malik qız Tütünçüoğlunun nəyini və nə kimi xüsusiyyətlərini sevir?* M.S.Ordubadi. [Bahar Sonanı] *mətanətli olmağa çağırırdı.* B.Bayramov.

**MƏTANƏTLİLİK** *is.* Mətanətli olma; mətinlik, dözümlülük, səbatlılıq, yenilməzlik, sarsılmazlıq.

**MƏTANƏTSİZ** *sif.* Mətanəti olmayan, mətin olmayan; davamsız, səbatsız. *Onlar sizin kimi savadsız da deyillər, mətanətsiz və iradəsiz də deyillər..* M.S.Ordubadi.

**MƏTANƏTSİZLİK** *is.* Mətanəti olmama; iradəsizlik, dözümsüzlük, səbatsızlıq.

**MƏTBƏƏ** *is.* [*ər.*] Kitab, qəzet və s. çap olunan müəssisə; çapxana, basmaxana.

**MƏTBƏƏÇİ** *is.* 1. Mətbəədə işləyən adam, mətbəə işçisi.

2. *köhn.* Mətbəə sahibi, mətbəəsi olan adam. *İndi* [Qədirlə Nəsir] *iki qardaş deyil, ağa ilə nökər, sahibkar ilə əmələ, mətbəəçi ilə mürəttib idilər.* S.Hüseyn.

**MƏTBƏƏÇİLİK** *is.* Mətbəə işi, kitab, qəzet və s. çap etmə sənəti.

**MƏTBƏX** *is.* [*ər.*] Xörək bişirmək üçün peçi, pilətəsi və s. ləvazimatı olan yer, otaq. *Müşkünaz .. mətbəxdə Ənvər üçün xörək hazırlayırdı.* Ə.Vəliyev. *Mətbəxin divarlarını his basmışdı.* Ə.Sadıq. // Qoşunlar hərəkətdə olarkən xörək bişirmək üçün qazanı və pilətəsi olan xüsusi maşın və ya araba. *Topçu mətbəxi. Səyyar mətbəx.*

**MƏTBƏXLİ** *sif.* Mətbəxi olan. *O biri də iki otaq və mətbəxli, qabağı eyvanlı təzəcə ev idi.* S.S.Axundov.

**MƏTBU** *sif.* [*ər.*] Çap olunmuş, çap edilmiş, nəşr olunmuş. *M.F.Axundzadənin mətbu əsərləri.*

**MƏTBUAT** *is.* [*ər.*] 1. Kitab, məcmuə və s. çap edən istehsalat sahəsi, nəşriyyat və mətbəə işi. *Mətbuat işçisi.*

2. Dövri çıxan qəzet, jurnal və s.-nin ümumi adı. *Xarici mətbuat. Dövri mətbuat. – Gizli mətbuat ilə tanış olmağa başladım..* T.Ş.Simurq. [Bəhlul:] *Mərziyənin .. mətbuatda tərifl ənməyi, fabrikin adının tez-tez çəkilməyi çoxunun xoşuna gəlmirdi.* B.Bayramov.

◊ **Mətbuat konfransı** – dövlət, siyasi, ictimai və elm xadimlərinin hər hansı bir məsələyə dair məlumat vermək, yaxud siyasi vəziyyəti işıqlandırmaq üçün mətbuat nümayəndələri ilə görüşü. *Mərkəzi jurnalistlər evində xarici jurnalistlər üçün mətbuat konfransı olmuşdur.*

**MƏTƏ** *is.* Yerdə oyun üçün çəkilən dairə (əsasən uşaq oyunlarında). *Mətədən çıxmaq.*

**MƏTƏ-MƏTƏ** *is.* Mətə içərisində oynanılan uşaq oyunu.

**MƏTƏRƏ** *is.* [*ər.*] Yolda, səfərdə, əsgərlikdə və s. istifadə edilən su qabı. *..Masanın üzərinə böyük bir mətərə buzlu ayran qoyulmuşdu.* M.S.Ordubadi.

**MƏTİN** *sif.* [*ər.*] 1. Bərk, möhkəm, sarsılmaz. *Mətin qayalara hiddətlə çarparaq çağlar; Səda verər iki yandan qaya, meşə, dağlar.* A.Şaiq. *..Bu şəhər bütöv bir çaxmaq daşından ibarət mətin bir qaya üzərində* [yerləşmişdi]. S.Rəhimov.

2. Mətanətli, səbatlı, dönməz, dayanıqlı, etibarlı, sarsılmaz. *Mətin qəhrəman. Mətin iradə. – Bu söz düzmü, doğrumu, bu əsrin mətin oğlu.* M.Müşfiq. [Ceyran] *cəsur, mətin, qəhrəman bir qadın idi.* S.Hüseyn.

**MƏTİNLƏŞDİRMƏK** *f.* Daha mətin etmək, dayanıqlılığını, mətanətini artırmaq, daha dözümlü etmək, möhkəmləndirmək.

**MƏTİNLƏŞMƏ** "Mətinləşmək"dən *f.is.*

**MƏTİNLƏŞMƏK** *f.* Daha da mətin olmaq, möhkəmləşmək, səbatlı, dözümlü olmaq.

**MƏTİNLİK** *is.* Mətanət, möhkəmlik, sarsılmazlıq, bərklik, davamlılıq, dayanıqlılıq. *Son hadisələr bu adamların mətinliyini daha da artırmışdı.* S.Rəhimov. *Ananın .. süzülən göz yaşları .. həm zəiflik, həm də mətinlik əlaməti idi.* B.Bayramov.

**MƏTLƏ** *is.* [*ər.*] *ədəb.* Qəsidə və ya qəzəlin ilk beyti (*məqtə* müqabili). // Giriş, müqəddimə, ilk söz.

**MƏTLƏB** *is.* [*ər.*] 1. Arzu, istək, dilək, istənilən şey, məqsəd. *Çox gözəl, çox yaxşıdır, lap Bakı məktəbidir; Məktəb bizim kolxozun çoxdankı mətləbidir.* R.Rza. ☐ **Mətləbə yetmək (nail olmaq, çatmaq), mətləbi hasil olmaq** – istəyinə nail olmaq, arzusuna çatmaq. *Oldu, sədşükr, mətləbim hasil.* S.Ə.Şirvani. **Mətləb hasil olmamaq** – xeyri olmamaq, heç bir şey çıxmamaq. *Kənarda bir neçə gəzib dolanan görsənirdi, amma bunların heç birindən mənə bir mətləb hasil olmadı.* C.Məmmədquluzadə.

2. Məsələ, məsələnin, işin mahiyyəti, əsil mənası, məğzi. *Naəhl olana mətləbi qandırmaq olurmu?* M.Ə.Sabir. *..Arifsən, gərək bir qıldan mətləbi başa düşəsən.* C.Məmmədquluzadə. [Əsgər:] *Hə, bəs mətləb elə buradadır ki, səhərdən bəri sənə deyirəm ki, axırı nə olsun.* Ü.Hacıbəyov. [Dərviş:] *Ruqiyyə mətləbi anladı, ətrafa baxdı..* A.Divanbəyoğlu.

3. Məsələ, iş. [Nurcahan:] *Mən Səfiqulunun xalasıyam, səninlə bir mətləb üstə danışmaq istəyirəm.* N.Vəzirov. *Bu sorğu-sualsız da onun üçün mətləb aydın idi.* S.Rəhimov. *Məsmə başını aşağı salıb çətin bir mətləb qarşısında özünü itirmiş kimi dururdu.* Mir Cəlal. ☐ **Mətləb üstə gəlmək (keçmək, qayıtmaq)** – əsas məsələdən danışmaq, əsas məsələyə keçmək, əsas məqsədini demək. *Burada bir balaca haşiyə çıxıb da mətləb üstə qayıdarıq.* Ə.Haqverdiyev. [Dədə Qorqud] *Qoçər ilə ozan dililə danışdı, mətləb üstə gəldi.* M.Rzaquluzadə. *Fərman yavaş-yavaş mətləb üstə keçdi.* Mir Cəlal. **Mətləbə dəxli yoxdur** – əsas məsələyə aid deyil, işə dəxli yoxdur.

**MƏTLUB** *is.* [*ər.*] *klas.* Tələb olunan, arzulanan, istənilən şey; arzu, istək. *Dedim: – Məcnun kimi çöldə qalmışam; Dedi: – Mən ki, mətlubumu almışam.* Aşıq Cəlal.

**MƏTN** *is.* [*ər.*] 1. Yazılmış və ya çap edilmiş halda olan hər cür nitq (ədəbi əsər, sənəd və i.a., habelə onlardan bir hissə, bir parça). *Pyesin mətni.* // Əsasən tədris üçün olan hər hansı ədəbi əsərin müəyyən hissəsi. *Farsca mətni tərcümə etmək.*

2. Bir yazının, ona verilən şəkil, şərh, kommentariya və qeydlərinə verilən izahatdan fərqli olan əsas hissəsi, əsli. *Kitabın mətni.*

3. Musiqi əsərinin sözləri, yazısı. *Operanın mətni.*

**MƏTNŞÜNAS** *is.* [*ər.* mətn və *fars.* ...şünas] Mətnşünaslıq mütəxəssisi.

**MƏTNŞÜNASLIQ** *is.* Filologiyanın, ədəbi abidələrin və tarixi sənədlərin dəqiq mətnini müəyyənləşdirməklə məşğul olan sahəsi.

**MƏVA** *is.* [*ər.*] *klas.* Yurd, məskən, məkan, yer. *Hər kəsin var bir mənzili, məvası; Aləmdə Zakir tək avara kimdir?* Q.Zakir. *İştə Qafqaz!.. Səfalı bir məva; Allah-Allah, nədir bu abü həva!* H.Cavid. // *məc.* Yuva. *Həm gözəl, həm yeyin tik ruhumun məvasını; Əldən-ayaqdan düşən qəlbimim sevdasını.* M.Müşfiq.

**MƏVACİB** *is.* [*ər.*] *köhn.* Maaş, əmək haqqı. [Qulu:] *Mən hətta bir neçə adam bilirəm ki, mənim ağamdan az məvacib alırlar.* N.Nərimanov. [Əmrah:] *Ayda iki manat məvacib verirlər, onu da adama zəhrimardan pis eləyirlər.* Ə.Haqverdiyev. [Pristav qorodovoylara:] *Müftəcə məvacib alıb, il uzunu bircə qəpikliksə də iş görmək istəmirsiniz..* Çəmənzəminli.

**MƏVACİBLİ** *sif.* Maaşlı, əmək haqqı ilə olan.

**MƏYUS** *sif.* və *zərf* [*ər.*] Ümidsiz, ümidini kəsmiş, ruhdan düşmüş; naümid; qəmli, qüssəli, bikef, pərişan, pərt. *Məyus adam. Məyus oturmaq.* – [Nemət] *yorğun və məyus bir halda evə dönüb yatdı.* Çəmənzəminli. *Uşaq firtıqlı burnunu çəkib, məyus nəzərlərini anasına dikdi.* M.İbrahimov. ☐ **Məyus etmək** – naümid etmək, ümidini qıraraq qəmləndirmək, ruhdan salmaq, kefini pozmaq, pərt eləmək. **Məyus olmaq** – ümidini itirərək bikef olmaq, ruhdan düşmək, pərt olmaq. *Ah, səd ah ki, dildardən oldum məyus; Soldu gül, gülşənü gülzardən oldum məyus.* S.Ə.Şirvani. *İş adamlarda elə bir ruh yüksəkliyi oyatmışdı ki, oraya buraxılmayan şagirdlər çox məyus olmuşdular.* H.Seyidbəyli.

**məyus-məyus** *zərf* Məyus halda, pərişan halda; məyuscasına. *Məyus-məyus oturmaq.* – *Molla Tanrıverdi məyus-məyus baxırdı, yenə də nitqi olmadı ki, danışsın.* E.Sultanov. *Kosa məyus-məyus, göz yaşlarını axıda-axıda qapını açıb çıxdı.* S.Rəhimov.

**MƏYUSANƏ** [*ər.* məyus və *fars.* ...anə] bax **məyuscasına**.

**MƏYUSCASINA** *zərf* Məyus halda; məyus-məyus. *Məyuscasına cavab vermək.*

**MƏYUSLAŞMA** "Məyuslaşmaq"dan *f.is.*

**MƏYUSLAŞMAQ** *f.* Məyus olmaq, əhvalı pozulmaq, ruhdan düşmək. *Pis xəbərdən məyuslaşmaq.*

**MƏYUSLUQ** *is.* Arzunun baş tutmaması üzündən insanda əmələ gələn kədər, ruh düşkünlüyü, pərişanlıq, ümidsizlik hissi. *Məşədi Əhmədin ailəsində böyük bir məyusluq davam edib gedirdi.* S.Hüseyn. [Nizami:] *Qəhrəman insanların böyük düşməni məyusluqdur.* M.Hüseyn.

**MƏZAC** *is.* [*ər.* mizac] 1. Xasiyyət, təbiət; temperament.

2. Əhval, hal. *Həsən bəyin məzacı necədir?* A.Şaiq. ☐ **Məzacı pozulmaq** – halı (əhvalı) pozulmaq, xəstələnmək, naxoşlamaq. *Sən demədinmi, dumada rəf olur ehtiyacımız? Mən demədimmi, çox yemə, tez pozular məzacımız?* M.Ə.Sabir. **Məzacı çəkməmək (götürməmək)** – ürəyi götürməmək, könlü (təbiəti) çəkməmək, istəməmək. *Bu xörəyi məzacım çəkmir.*

**MƏZAR** *is.* [*ər.*] Qəbir. *Mən bu dərd ilə əgər ölsəm, məzara qoymayın; Üstümə ol tuti dilli şux nigarım gəlməmiş.* M.P.Vaqif. *Qazdır məzarımı çeşmə başında; Sal sinəm üstündən yol, incimərəm.* Aşıq Ələsgər.

**MƏZARÇI** bax **qəbirqazan** 1-ci mənada. [Musa] *Raufla Məsud getdiyi tərəfə baxaraq məzarçıya* [deyir]. H.Cavid. [Şair:] *Məzarçı qəbrimi dərin qazacaq.* M.Rahim.

**MƏZARDAŞI** bax **qəbirdaşı**. [Murad] *bir qismi ərəbcə və farsca, bir qismi türkcə yazılan məzardaşlarının sahiblərinin vəfat tarixlərini oxuyurdu.* S.Hüseyn. *Hər saxsı parçası, hər məzardaşı; Nəsildən-nəsilə bir yadigardır.* S.Vurğun.

**MƏZARISTAN** [*ər.* məzar və *fars.* ...stan] bax **qəbiristan**. [Xacə Firuz:] *Məlun sənsən ki, məmləkəti məzarıstana döndəribsən!* Ə.Haqverdiyev. *Baxışoğlu Həsən məzarıstana getdiyi vaxt öz qulağı ilə Molla Əkbərin ağzından bu sözləri eşitmişdi.* B.Talıblı.

**MƏZARLIQ** *is.* Qəbiristan. *Kim baxarsa haçan bizim şəhərə; Bir məzarlıq kimi gəlir nəzərə.* A.Səhhət. *Bürümüş ən nəhayət kölgələr baxışını; İndi gözəl xəyalı məzarlıq aləmində.* M.Müşfiq.

**MƏZDƏKİ(LƏR)** *is.* Məzdəkizm hərəkatının iştirakçılarına verilən ad.

**MƏZDƏKİLİK** bax **məzdəkizm**.

**MƏZDƏKİZM** *is. tar.* V-VI əsrlərdə İranda Məzdəkin rəhbərliyi altında feodallara və ruhanilərə qarşı yönəldilmiş xalq hərəkatı.

**MƏZDƏMƏ** "Məzdəmək"dən *f.is.*

**MƏZDƏMƏK** *f. dan.* 1. İcazəsiz və təklifsiz acgözlüklə yemək. *Xörəyi məzdəmək.*

2. *məc.* Mənimsəmək, içəri salmaq. [Əhməd:] *Mənim də əlimə düşəydi sənin pulların, nə səliqə ilə məzdərdim.* N.Vəzirov.

**MƏZƏ** *is.* [*fars.*] 1. Adətən iştaha üçün əsas yeməkdən qabaq və ya onunla birlikdə, yaxud içki içilərkən yeyilən müxtəlif yüngül yeməklər; çərəz. *Süfrəyə məzə düzmək. – Kimi qəhvə, kimi şokolad, təyyarəçi də çaxır ilə məzə istədi.* Çəmənzəminli. [Qurban] .. *şərab şüşələrini və xüsusi səliqə ilə hazırlanmış məzələr çıxarıb, süfrə tədarükünə məşğul oldu.* T.Ş.Simurq. *..Məzələr, xuruşlar boşqablara düzülmüşdü.* M.Rzaquluzadə.

2. Ləzzət, dad, tam. *Xörəyin məzəsi ağzından getmir.*

3. *məc.* Naz, işvə, qəmzə, şivə. [Dürrə] *qızlara məxsus bir məzə ilə gülümsədi.* S.Vəliyev. □ **Məzə vermək** – qəmzə satmaq, naz eləmək.

4. *məc.* Yumor, gülməli şey. *..Amma məzə burasıdır ki, yağış da .. başlayır şıdırğı ilə yağmağa.* "Mol. Nəsr." [Ustanın] *mülayim, ahəngdar səslə, hərdənbir məzə ilə dediyi xatirələrini cavanlar şirin söhbət kimi eşidirdilər.* Mir Cəlal.

**MƏZƏLİ** *sif.* 1. Dadlı, ləzzətli, tamlı. *Məzəli xörək. – Vəsf eylədiyim zövqlə ənhari-behiştin; Kövsər məzəli şərbəti-reyhanın üçündür.* M.Ə.Sabir.

2. Əyləndirici, könülaçan, gülməli, güldürücü, duzlu. *Məzəli söhbətlər. Məzəli* (z.) *danışmaq. – Qulaq as, duzlu bir hekayətdir; Məzəli, gülməli rəvayətdir.* Ə.Qəmküsar. [Yazgül:] *Fəridənin* [uşağı] *elə məzəli çağadır ki, ay ana!..* Ə.Məmmədxanlı. *O, hər bir fikrini maraqlı, məzəli sözlərlə deməyə çalışırdı.* S.Vəliyev. // Maraqlı, qəribə. *Mən deyirəm, bütün Qafqaziyyə vilayətində bizim Danabaş kəndi kimi məzəli kənd yoxdur.* C.Məmmədquluzadə.

3. Məzəsi olan, çərəzli (b a x **məzə** 1-ci mənada). *Məzəli süfrə.*

**MƏZƏLİLİK** *is.* Məzəli adamın hal və hərəkəti; oyunbazlıq, təlxəklik. □ **Məzəlilik etmək (eləmək)** – gülməli hərəkətlər etmək, oyun çıxartmaq, hoqqabazlıq etmək, təlxəklik etmək. [Pəri Cadu:] *Bu da bizim dəlimizdir. Belə məzəlilik edir.* Ə.Haqverdiyev. [Qasım:] *Əşi, nə danışırsan? Məzəlilik eləmə!* S.Rəhimov. **Məzəliliyə salmaq** – zarafata salmaq, məzəli sözlərlə başını tovlamağa çalışmaq. *Hümmət məzəliliyə salıb,* [kolxozçuları] *başından eləməyə çalışdı.* B.Bayramov.

**MƏZƏLLƏT** *is.* [*ər.*] Zəlillik, həqarət, alçaqlıq, xarlıq, etibarsızlıq. *Məzəllətdə yaşamaq.*

**MƏZƏMMƏT** *is.* [*ər.*] Danlama, qınama, danlayış, töhmət. *İctimai məzəmmət. – Uşaqlara Xudayar bəyin məzəmməti tük qədər də kar eləmədi.* C.Məmmədquluzadə. // Narazılıq, məmnunsuzluq. [Rəşid:] *..Onun ilıq təbəssümündə, yorğun baxışlarında bir məzəmmət duyurdum.* İ.Hüseynov. □ **Məzəmmət etmək** – b a x **məzəmmətləmək**. *Uşağı məzəmmət etmək. – Dədəm başladı gündə məni məzəmmət eləməyə.* Çəmənzəminli. *Xalamın əri Mürsəl kişi gecikdiyim üçün məni və atamı məzəmmət edirdi.* Ə.Məmmədxanlı.

**MƏZƏMMƏTEDİCİ** *sif.* Məzəmmətli, töhmətli. *Məzəmmətedici nəzər.* – [Mirhaşım] *məzəmmətedici baxışlarla Şücanizama baxdı.* P.Makulu.

**MƏZƏMMƏTLƏMƏ** "Məzəmmətləmək"dən *f.is.*

**MƏZƏMMƏTLƏMƏK** *f.* Məzəmmət etmək, danlamaq, qınamaq. *..Gülara xanım* [qızı] *məzəmmətləməyə başladı.* S.Rəhman. [Gülnaz] *gənclə görüşə razılıq verdiyi üçün özünü məzəmmətlədi.* Q.İlkin.

**MƏZƏMMƏTLƏNMƏ** "Məzəmmətlənmək"dən *f.is.*

**MƏZƏMMƏTLƏNMƏK** *məch.* Məzəmmət olunmaq, danlanmaq. *Uşaq nahaq yerə məzəmmətləndi.*

**MƏZƏMMƏTLİ** *sif.* Töhmətli, danlaqlı, töhmətləndirici, məzəmmət ifadə edən. *Məzəmmətli söz. – Oğlunun bu məzəmmətli sualı, deyəsən, kişinin ürəyini qanatdı.* M.Rzaquluzadə. [Cavan kəndli] *Namazın da üzündə məzəmmətli bir ifadə oxuyub, başını aşağı saldı.* P.Makulu.

**MƏZƏNNƏ** *is.* [*ər.*] 1. Bazar qiyməti, nırx, müəyyən olunmuş qiymət. *Günün məzənnəsi.* – [Axund:] [Xoruzu] *məzənnədən aşağı satmayasan.* B.Talıblı. □ **Məzənnə qoymaq** – nırx təyin etmək, qiymətini müəyyənləşdirmək. **Məzənnəsi düşmək** – qiyməti aşağı düşmək; ucuzlaşmaq.

2. a) qiymətli kağızların, xüsusi dövlət normativ aktları ilə müəyyənləşdirilən qiyməti; b) birjada səhmlərin, istiqraz vərəqələrinin, veksellərin və s. alınıb-satıldığı

qiymət; kurs. *..Fransa müharibədən sonra öz valyutasının məzənnəsini dəfələrlə aşağı salmışdır.*

**MƏZƏNNƏLƏŞMƏ** "Məzənnələşmək"-dən *f.is.*

**MƏZƏNNƏLƏŞMƏK** *qarş.* Qiyməti müəyyənləşmək, qiymət qoymaq, kəsişmək, sövdələşmək. *Danışıb məzənnələşmək.*

**MƏZHƏB** *is.* [*ər.*] 1. Din. *İslam məzhəbi. Xristian məzhəbi. – Əgər övrəti bu əməldən xəbərdar olsa, haman saat ərindən boşanar və boşanmağına da məzhəbləri ixtiyar verər.* C.Məmmədquluzadə. *Bizim babalar məzhəb ayrılığını bəhanə edib çara əsgər vermirdilər.* M.Rzaquluzadə. // Dini cərəyanlardan hər biri; təriqət. [Yaşlı kişi:] *Fəqət müxtəlif məzhəb və təriqətlərə mənsub olan müsəlmanlar hamısı bu barədə müttəfiq deyillər.* S.Hüseyn.

2. *köhn.* Məslək, əqidə mənasında. *İki nəfər vəkil yenə müsəlmançılıqdan çıxıb sosial-demokrat məzhəbinə daxil olublar.* C.Məmmədquluzadə.

◊ **Ara qarışıb məzhəb itmək** – b a x **ara**.

**MƏZHƏBSİZ** *sif.* 1. Dinsiz, dinə inanmayan, laməzhəb.

2. Söyüş kimi işlədilir.

**MƏZHƏKƏ** *is.* [*ər.* müzhikə] 1. Gülməli, güldürücü danışıq, söhbət, hərəkət, oyun; əhvalat, lətifə. *Yol uzunu Məmmədrza məzhəkə söyləyərək məni güldürürdü.* S.S.Axundov. *Usta Murtuz xəstənin ürəyini açmaq üçün şirin söhbətlər elədi, məzhəkə dedi.* Mir Cəlal.

2. Komediya. *Ərəstu faciəni məzhəkədən ayırmaq istəmişdir.* Ə.Sultanlı.

◊ **Məzhəkəyə qoymaq** – ələ salıb gülmək, araya qoymaq, lağa qoymaq. *Bu saat sizi aparacağam dəlixanaya, orada ağlınız başınıza gələr və dəxi həzrətin tumanbağısını məzhəkəyə qoymazsınız.* C.Məmmədquluzadə.

**MƏZHƏKƏÇİ** *is.* Oyun, yaxud gülməli sözlərlə adamları güldürən adam; oyunbaz, təlxək. *Padşahın nədimləri, məzhəkəçiləri onu əyləndirmək üçün gülməli nömrələr hazırlayır və məşq edirdilər.* M.S.Ordubadi. // Kloun, komik artist, komik.

**MƏZHƏKƏÇİLİK** *is.* Məzhəkəçinin işi, peşəsi; gülməli oyunlar çıxarma; təlxəklik, oyunbazlıq. *..Müdir izahat verərək dedi: – Bu qızlar məzhəkəçilik və nədimlik öyrənmiş qızlardır.* M.S.Ordubadi.

**MƏZHƏKƏLİ** *sif.* Məzmununda məzhəkə olan; gülməli, güldürücü. *Məzhəkəli danışıq.*

**MƏZHƏKƏNƏVİS** *is.* [*ər.* məzhəkə və *fars.* ...nəvis] *köhn.* b a x **məzhəkəyazan**.

**MƏZHƏKƏNƏVİSLİK** *is. köhn.* Məzhəkə yazma sənəti; komedioqraflıq. *..Məzhəkənəvislikdə* [Qoqola] *bərabər Rusiyada hələ bir kəs tapılmayıb.* C.Məmmədquluzadə.

**MƏZHƏKƏYAZAN** *is.* Komediya yazan yazıçı; komedioqraf. *Varmı şerimizdə məzhəkəyazan? Oxucu gözləyir bunu hər zaman.* S.Vurğun. *XIX əsrin sonu və XX əsrin əvvəllərində .. kiçik məzhəkəyazanlar, vodevilçilər də yox deyildi.* Ə.Sultanlı.

**MƏZİYYƏT** *is.* [*ər.*] Bir şeyin, adamın üstünlüyünü təşkil edən xüsusiyyəti. *Hər bir şairin, yazıçının, dramaturqun ən böyük məziyyətlərindən birisi onun mövzu seçməyi bacarmasıdır.* C.Cabbarlı. [Zeynal] *hər kəslə tanış olduqda özünün məziyyətlərindən bəhs etməyi sevərdi.* S.Hüseyn.

**MƏZİYYƏTLİ** *sif.* Yaxşı xüsusiyyətləri ilə seçilən; üstün.

**MƏZKUR** *sif.* [*ər.*] *kit.* Zikr olunmuş, adı çəkilmiş, haqqında danışılmış; yuxarıdakı. *Məzkur şəxs. Məzkur əhvalat. – Şəxsi-məzkur Qəzvinin qəryələrindən Kərbəlayı Səlim adlı bir dehqanın oğlu idi.* M.F.Axundzadə. *Bahadır bir ağanın dalına qısılıb, məzkur qızı yaxşı manşırladı.* N.Nərimanov.

**MƏZLUM** *sif.* və *is.* [*ər.*] 1. Zülm çəkmiş, zülm olunmuş, zülmə məruz qalmış, zülm altında olan (*zalım* əksi). *Məzlum xalq. Məzlum adam. – Məzlumların göz yaşı dərya olacaqmış; Dəryaları, ümmanları neylərdin, ilahi?!* M.Ə.Sabir. *Ölümlərin pəncəsində hıçqıran; Məzlumların nəvasından yarandım.* M.Müşfiq.

2. Fağır, yazıq, zavallı, dilsiz-ağızsız. *Məzlum uşaq. – Onu qaçırsa Səfər ilə Ballı qaçıracaq, yoxsa Allahın məzlumudur.* A.Şaiq. ..[Qədir] *təcrübəsiz, aciz, məzlum bir insan idi.* Mir Cəlal.

**məzlum-məzlum** *zərf* Yazıq-yazıq, fağır-fağır, zavallı-zavallı, məzlumcasına. *Göyçək gözləri ilə Məmmədin üzünə məzlum-məzlum baxırdı.* E.Sultanov. [Səlim] *pərtliyi aradan*

*qaldırmaq üçün məzlum-məzlum gülümsündü.* B.Bayramov.

**MƏZLUMANƏ** [*ər.* məzlum və *fars.* ...anə] bax **məzlum-məzlum**. *Məzlumanə xahiş. – Mehriban, dərdli başını məzlumanə bir tərzdə qaldırıb .. baxdıqda Səlimi gördü.* S.Hüseyn. *Nə düşkün bir sehr, yarəb! Nə məzlumanə bir fitrət!* H.Cavid.

**MƏZLUMCASINA** bax **məzlum-məzlum**.

**MƏZLUMLUQ** *is.* Məzlum adamın halı; fağırlıq, yazıqlıq. *Məzlumluq edib başlama fəryadə, əkinçi! Qoyma özünü tülkülüyə, adə əkinçi!* M.Ə.Sabir. [Kor Seyid] *məzlumluğu sevən, miskinlikdən ruhani bir zövq alan adam idi.* S.Hüseyn.

**MƏZMUN** *is.* [*ər.*] 1. Əsərdə, kitabda, məqalədə, şəkildə və s.-də şərh olunan, haqqında danışılan, əks etdirilən şeyin mövzusu, əsas şərhi. *Romanın məzmunu. Operanın məzmunu.* // Kitabın və ya başqa bir əsərin fəsillərinin və ya başqa tərkib hissələrinin siyahısı; mündəricə.

2. Mətləb, məsələ, mövzu. *Fəxr edirəm ki, məcmuəmin ancaq şəkillərinə baxıb kənara tullamırsınız, içində yazdığım məzmunları oxuyursunuz.* C.Məmmədquluzadə. // *fəls.* Hadisə, yaxud prosesin mahiyyətini müəyyənləşdirən əsas xüsusiyyət. *Forma və məzmun. İnqilabın ictimai və siyasi məzmunu.* // Bir şeyin mənası, mahiyyəti.

**MƏZMUNCA** *sif.* Məzmuna görə, məzmun etibarilə, mənaca. *Məzmunca yaxşı poema.*

**MƏZMUNLU** *sif.* və *zərf* Məzmunu zəngin, dolğun olan, ciddi, dərin mənalı. *Məzmunlu pyes. Məzmunlu* (z.) *danışmaq. –* "*Millətdən ötür ağlıyan axırda olur kor*"; *Məzmunlu məsəldir bu ibarət, uçitellər!* M.Ə.Sabir.

**MƏZMUNLULUQ** *is.* Məzmunca dolğunluq, zənginlik, dərinlik; mənalılıq, ciddilik. *Əsərin məzmunluluğu.*

**MƏZMUNSUZ** *sif.* və *zərf* Məzmunca sönük, kasıb, çox maraqsız; boş, mənasız. *Məzmunsuz əsər.*

**MƏZMUNSUZLAŞDIRMA** "Məzmunsuzlaşdırmaq"dan *f.is.*

**MƏZMUNSUZLAŞDIRMAQ** *f.* Məzmundan məhrum etmək; mənasızlaşdırmaq, bayağılaşdırmaq.

**MƏZMUNSUZLUQ** *is.* Məzmunca sönüklük, kasıblıq, boşluq, maraqsızlıq, mənasızlıq. *Oçerkin məzmunsuzluğu.*

**MƏZUN** *is.* [*ər.*] Hər hansı bir məktəbi (universitet, institut, texnikum, kurs və s.) bitirmiş tələbə, şagird. *İnstitutun məzunları. Texnikum məzunları. – Ancaq Məlikzadə heç bir gənc məzun üzərində bu qədər təkid etməmişdi!* S.Rəhimov.

**MƏZUNİYYƏT** *is.* [*ər.*] İşləyən adama istirahət, müalicə və s. üçün verilən müəyyən vaxt. [Muxtar] *bir aylıq məzuniyyətini böyük şəhərdə keçirmək niyyətində idi.* Çəmənzəminli. ☐ **Məzuniyyətə çıxmaq** – istirahət və b. məqsəd üçün müəyyən edilmiş müddətə işindən azad olmaq. *Zeynal on gün əvvəl məzuniyyətə çıxmış, .. mədən sularına getmişdi.* S.Hüseyn.

**MƏZUNİYYƏTÇİ** *is.* Məzuniyyətdə olan adam.

**MƏZUR** *sif.* [*ər.*] Üzrü olan, üzürlü, səbəbli. *Həm o babətdə də biz məzuruq; Çünkü biz tərbiyəyə məmuruq.* A.Səhhət. [Şeyx Sənan:] *Məni, şeyxim, bağışla, məzurəm.* H.Cavid. ☐ **Məzur görmək (saymaq, tutmaq)** – üzürlü hesab etmək, üzrünü qəbul etmək, səbəbli saymaq. [Student:] *Sizi narahat etməyə məcbur qaldım, məni məzur görünüz.* Çəmənzəminli. [Şeyda:] *Atamın da səhvi orasındadır ki, bizi həmişə uşaq cərgəsində qoyur, məni məzur tutun.* B.Bayramov.

**MƏZYƏDİ** *is.* [*ər.*] IX-X əsrlərdə Şirvanşahlar sülaləsi.

**MICIR** *is. məh.* Keçi balası, çəpiş, oğlaq.

**MIĞILDAMAQ** *f.* Öz-özünə gülümsəmək. *Uşaq mığıldayır.*

**MIĞILTI** *is.* Öz-özünə gülümsəmə. *Uşağın mığıltısı eşidilirdi.*

**MIĞMIĞ, MIĞMIĞA, MIĞMIĞI** *is.* Ağcaqanad. *Palıdlı meşənin qaranlığında; Yay günü mığmığa olur əjdaha.* H.K.Sanılı. *Mığmığı sancır insanı; Dönüb zəhərlənir insanın qanı.* S.Vurğun.

**MIX** *is.* [*fars.*] 1. Mismar. *İri mıx. Ayaqqabı mıxı. Divara mıx vurmaq.*

2. Yerə, divara çalınan ucuşiş ağac parçası. *Qatır mıxın qopardar, biri yerə dəyər, ikisi özünə.* (Ata. sözü). [Dərviş:] *Dana-buzovları*

*mıxlarından açıb o biri tərəfə otlamağa yellədim.* A.Divanbəyoğlu.

◊ **Mıx kimi** *dan.* – 1) dümdüz, dik. *Uşaq mıx kimi dayandı;* 2) möhkəm, sarsılmaz.

**MIXABƏNZƏR, MIXVARİ** *sif.* Mıx kimi, mıx şəklində.

**MIXÇA** *is.* 1. Kiçik mıx, kiçik mismar. *Ayaqqabı mıxçası.*

2. Paltar və s. asmaq üçün divara vurulmuş mıx. *Paltarı mıxçadan asmaq.* – [Nəriman] .. *papağını mıxçadan götürdü.* Mir Cəlal. [Niyaz] *əynindəki köhnə pencəyini çıxarıb orta dirəkdəki mıxçadan asdı.* Ə.Vəliyev.

3. Kiçik paya, ağac parçası. *Əziz kişi çadırın mıxçalarını tapıb gətirdi.* B.Bayramov.

**MIXÇALAMA** "Mıxçalamaq"dan *f.is.*

**MIXÇALAMAQ** *f.* Mıxça çalmaq, mıxça vurmaq, mıxlamaq.

**MIXÇALANMA** "Mıxçalanmaq"dan *f.is.*

**MIXÇALANMAQ** *məch.* Mıxça vurulmaq, mıxça çalınmaq; mıxlanmaq.

**MIXÇALI** *sif.* Mıxçalanmış, mıxça vurulmuş, mıxçası olan. *Sabah tezdən kərbəlayı başı mıxçalı çomağı götürüb, məşədinin həyətinə baxıb öskürür.* Çəmənzəminli.

**MIXLAMA[1]** *məch.* Xüsusi qaydada bişirilmiş qayğanaq.

**MIXLAMA[2]** "Mıxlamaq"dan *f.is.*

**MIXLAMAQ** *f.* 1. Mıx çalmaq, mismarlamaq, mıx vurmaq, mıx vurub bərkitmək. *Qapını mıxlamaq. Taxtanı mıxlamaq. – İki nəfər uşaq əldə çəkic hazır yeşiklərin qapağını mıxlayırdı.* Mir Cəlal.

2. *məc.* Möhkəm vurmaq, vurub bərkitmək. *Mıxlayıb sanki günəş istisini yer üzünə; Sanki burdan yayılır od ləpəsi Mil düzünə.* S.Rüstəm.

**MIXLANMA** "Mıxlanmaq"dan *f.is.*

**MIXLANMAQ** *məch.* 1. Mıx vurulmaq, mıx vurulub bərkidilmək; mismarlanmaq. *Limon yeşiyi pəncərəyə qoyulmuşdu, hələ ağzı mıxlanmamışdı.* Mir Cəlal.

2. Mıxdan asılmaq, mıxla bərkidilmək, mıxla vurulmaq. *Nəcəf artırmanın dirəyinə mıxlanmış balaca əlüzyuyana yaxınlaşdı.* M.İbrahimov. *Yan divarlara günün vacib məsələlərinə dair plakatlar .. mıxlanmışdı.* Ə.Əbülhəsən.

3. *məc.* Bir yerə yapışıb qalmaq, yerindəcə dayanıb durmaq, yerindən tərpənməmək. [Yoldan keçənlər:] *Bacı, nə verəcəklər? – deyə sorur, bəziləri yolundan qalıb növbəyə mıxlanırdı.* Qantəmir. *Rüstəm kişi stula mıxlanıb qaldı, qulağına inanmadı.* M.İbrahimov. // *məc.* Bağlanmaq, bənd olmaq. *O başladığı işlə buraya daha da mıxlanmışdı.* S.Rəhimov. *Yəqin ki,* [Bəyim] *indi anası ilə danışır və mənim buraya mıxlanıb qaldığımı heç ağlına da gətirmirdi.* İ.Əfəndiyev.

**MIXLATMA** "Mıxlatmaq"dan *f.is.*

**MIXLATMAQ** *icb.* Mıx vurdurmaq, mıxla bərkidilmək; mismarlatmaq. *Qutunu mıxlatmaq.*

**MIXLI** *sif.* Mıx çalınmış, mıx vurulmuş, mıxla bərkidilmiş; mismarlı.

**MIQQILDAMA** "Mıqqıldamaq"dan *f.is.*

**MIQQILDAMAQ** bax **nıqqıldamaq**. ..*Uşaq gözlərini bərəldir və mıqqıldayıb istəyir qaça.* C.Məmmədquluzadə. *Tapdıq yenə də mıqqıldadı.* Ə.Vəliyev.

**MIQQILDANMA** "Mıqqıldanmaq"dan *f.is.*

**MIQQILDANMAQ** bax **nıqqıldanmaq**.

**MIQQILTI** *is.* İnilti, zarıltı. *Tapdıq, elə bil, eşitmir, mıqqıltısını artırırdı.* Ə.Vəliyev.

**MIRIQ** *sif.* 1. Qabaq dişləri çürümüş kötük halında olan, yaxud düşmüş. *Tapdığın bütün dişləri gəmirik və mırıqdı.* Ə.Vəliyev. *Qarakişi .. qapı-pəncərəyə baxıb mırıq dişləri arasından pıçıldadı.* B.Bayramov. // *İs. mənasında.* Çürük diş. ..*Bədirli yenə yaltaq bir təbəssümlə irişdi və onun alt çənəsindəki mırığı göründü.* M.Hüseyn.

2. Dovşandodaq.

**MIRILDAMA** "Mırıldamaq"dan *f.is.*

**MIRILDAMAQ** *f.* 1. Mır-mır etmək, mırıltı səsi çıxarmaq. *İt mırıldayır. – Piri kişi bir yeni şəxs ilə tanış olanda Qara köpək .. o adama dişlərini ağardıb mırıldasaydı,* [Piri kişi] *onu özünə düşmən bilərdi.* S.S.Axundov.

2. *dan.* Söylənmək, deyinmək, donquldanmaq. [Ağa Kərim xan:] *Burnunun altında nə mırıldayırsan, a gədə!* N.Vəzirov.

**MIRILDANMA** "Mırıldanmaq"dan *f.is.*

**MIRILDANMAQ** *qayıd.* 1. Dodaqaltı söylənmək, deyinmək, donquldanmaq. *Xan özözünə mırıldanıb başladı hirsindən saqqalının tüklərini yolmağa.* Çəmənzəminli. *Kəblə*

*Novruzqulu səsdən təngə gəlib mırıldanırdı*. H.Sarabski.

2. Mırıltı səsi çıxarmaq (itlər haqqında). *Tüfəngi çiyninə salıb səs-küysüz tövləyə girəndə ala köpək həyətdə mırıldandı..* M.Rzaquluzadə.

**MIRILTI** *is.* 1. İtlərin bir şeydən xoşlanmadıqları zaman çıxardıqları yavaş alçaq səs. [Dərviş:] *Malların göyşəyi, atların nəriltisi, gah-gah da itlərin mırıltısı qulağıma gəlirdi.* A.Divanbəyoğlu. *Gecələr töyləyə dolmuş sahibsiz kənd itlərinin mırıltısından başqa bir səs .. sükutu xələldar etmirdi*. M.İbrahimov.

2. *dan.* Deyinmə, söylənmə, donquldanma. *Onun mırıltısını kəssənə!*

**MIR-MIR** *təql.* Mırıltı səsi, mırıltı. *Mır-mır səsi eşidilir.* ☐ **Mır-mır mırıldamaq** *dan.* – dodaqaltı deyinmək, donquldanmaq, söylənmək. *Bundan yana dönüb isə mır-mır mırıldayır; Qoymur olam evimdə də rahət gavur qızı.* M.Ə.Sabir. *Birdən bir papiros yandırdı cəllad; Basdı gənc əsgərin iki gözünə; Mır-mır mırıldadı özü-özünə*. S.Rüstəm.

**MIRMIRI** *is. zool.* Ağbalıq.

**MIRT: mırt vurmaq** *dan.* – baş-başa verib söhbət etmək (adətən boş və əhəmiyyətsiz şeylər haqqında). [Xəlil mirzə ilə] *üzbəüzdə isə iki nəfər maxorka tüstülədə-tüstülədə mırt vururdu*. Q.İlkin.

**MIRTILDAMA** "Mırtıldamaq"dan *f.is.*

**MIRTILDAMAQ** *f.* Anlaşılmaz halda danışmaq; donquldanmaq, deyinmək, söylənmək.

**MIRTILDANMA** "Mırtıldanmaq"dan *f.is.*

**MIRTILDANMAQ** *qayıd.* Öz-özünə anlaşılmaz danışmaq; deyinmək, söylənmək, donquldanmaq. *Mən heç bilmirəm ki, bu nə bişməmiş sözdür? – deyə* [Dadaş Lələşov] *mırtıldandı*. S.Rəhimov.

**MIRTLAMA** "Mırtlamaq"dan *f.is.*

**MIRTLAMAQ** *f.* Dodaq altında danışmaq; deyinmək, söylənmək, donquldamaq. [Hafizə xanım:] *Nə mırtlayırsan, a gədə?* Ə.Haqverdiyev.

**MIRTLANMA** "Mırtlanmaq"dan *f.is.*

**MIRTLANMAQ** b a x **mırtıldanmaq**. *Gecənin, bilmirəm nə vaxtı idi, gördüm uşaqların anası öz-özünə mırtlanır*. C.Məmmədquluzadə.

**MIRT-MIRT** *zərf* Boş-boş, havayı. *Mırt-mırt söylənmək. – A kişi, bu kitabları və kağızları tulla cəhənnəmə, az bu cinlərnən və şəyatinlərnən mırt-mırt danış..* C.Məmmədquluzadə. *Mırt-mırt oxuyub mırıldayırsan; Qarğa kimi hey qırıldayırsan.* M.Ə.Sabir.

**MISMIRIQ** *is.* Acıqlı, hirsli, narazı adamın üzündə əmələ gələn hal; qaşqabaq. ☐ **Mısmırığı(nı) sallamaq** – sifətinə acıqlı, hirsli, yaxud narazı bir ifadə vermək, qaşqabağını sallamaq. *Xanpəri mısmırığını sallamış, qaşqabağını tökmüşdü*. Ə.Vəliyev. **Mısmırığı açılmaq** – danışmağa, gülməyə başlamaq, üzü gülmək, hirsi, acığı soyumaq, aynası açılmaq.

**MIŞHAMIŞ** *zərf* Sakit və şirin (uşağın yatmağı haqqında). *Uşaq mışhamış yatır.*

**MIŞILDAMA** "Mışıldamaq"dan *f.is.*

**MIŞILDAMAQ** *f.* Sakit-sakit, şirin-şirin, rahat-rahat yatmaq (uşaq haqqında). *Uşaq mışıldayırdı. – Firəngiz yuxulu-yuxulu Sabiri döşünə salır, bir azdan körpə mışıldayır, anasının qoynunda tamamilə sakitləşirdi*. S.Rəhimov. *Məryəm xala hələ də mışıldayan uşağı bağrına basıb otağa tərəf yollandı*. M.İbrahimov.

**MIŞIL-MIŞIL** b a x **mışhamış**. *Körpə mışıl-mışıl yatırdı. – Mədinə arvad lap yaxınlaşdıqda yorğanın ucunu qaldırdı, mışıl-mışıl yatan çağanın üzünə baxdı.* S.Rəhimov. [Cavad] *Zöhrənin böyründə mışıl-mışıl yatan Aslana həsrətlə baxdı.* Ə.Vəliyev.

**MIŞILTI** *is.* Rahat-rahat, dərin-dərin, şirin-şirin, mışhamış. [Şirmayı] *əlinin birini böyrünə, birini də başının altına qoyub mışıltı ilə yatırdı.* M.Hüseyn. *Salman .. mışıltı ilə yatmış Elxanın beşiyinin yanını kəsdirdi.* S.Rəhimov.

**MIŞOVUL** *is. zool.* Dələ ailəsindən zərif bədənli, çevik, kiçik yırtıcı.

**MIZ** *is. zool.* Sirkə və başqa turş şeylərin üzərinə yığılan xırda milçək.

**MIZI** *sif.* Azdanışan, həmişə qaşqabaqlı, üzügülməz, yaxud danışığından bir şey başa düşülməyən. [Şahbəy:] *O günü Bülənd bura gəlmişdi, heç deyinən, kəlmə kəsdinmi? Yanı o özü də elə mızı adamdır!* Ə.Əbülhəsən.

**MIZILDAMA** "Mızıldamaq"dan *f.is.*

**MIZILDAMAQ** *f.* Dodaqaltı danışmaq, anlaşılmaz danışmaq və ya oxumaq. *Yarməmməd nə isə dodaqarası anlaşılmaz bir şey mızıldadı.* M.İbrahimov. *Falçı içəri girən kimi mızıldamağa başladı.* P.Makulu. *Çarpayıya uzanıb rahatlandım, mızıldayıb mahnı dedim.* Mir Cəlal.

**MIZILDANMA** "Mızıldanmaq"dan *f.is.*

**MIZILDANMAQ** *qayıd.* Deyinmək, söylənmək, donquldanmaq. *Nisə artıq dodağının altında mızıldanmağa başlayırdı.* M.Hüseyn. *Qalınqaş oğlan kameraya dönəndə qarovulun eşidəcəyi səslə mızıldandı: – Qudurubdu zalım oğlu, nədi?* Mir Cəlal.

**MIZILTI** *is.* Mızıldama səsi. *Bir mızıltı eşitdim*. – [Yarməmmədin] *mızıltısından bir şey başa düşməyən Qara Kərəm soruşdu.* M.İbrahimov. *Ədhəm sağ əlini sol sinəsində gəzdirə-gəzdirə xeyli dayandı, gözünü döydü, dolandı, axırda mızıltısı o yandan gəldi*. B.Bayramov.

**MIZMIZ(I)** *sif. dan.* Aydın danışmayan, burnunda danışan, danışığı başa düşülməyən. *Mızmız adam.*

**Mİ** [*lat.*] Musiqi qammasının üçüncü səsi, habelə bu səsi göstərən not.

**MİÇƏTKƏN** *is.* Ağcaqanad, milçək və s. qanadlı həşəratlardan qorunmaq üçün cunadan (tənzifdən) tikilən yataq örtüyü. *Miçətkən qurmaq. Miçətkəndə yatmaq*. – [Kişi:] *Bu bizim qonağa bir yaxşı nömrə ver, miçətkəni də olsun.* Çəmənzəminli.

**MİÇMAN** [*ing.*] 1. Rus hərbi dəniz donanmasında starşina heyətində ən böyük ad, habelə bu cür adı olan şəxs.

2. Çar Rusiyasının hərbi dəniz donanmasında ilk zabit rütbəsi, habelə bu cür rütbəsi olan şəxs.

**MİÇURİNÇİ** *is.* Biologiyada və kənd təsərrüfatında əsası rus alimi İ.V.Miçurin tərəfindən qoyulmuş elmi üsulların davamçısı.

**MİDBƏR** *is.* Heyvan boynuna bağlanan ipə keçirilən halqa. *Midbəri ipə bənd etmək.*

**MİDİYALI** *is. tar.* Qədim Midiya əhlindən olan. *Burada qəbilə düzəldən, buranı abad edən midiyalı Cəməsb olmuşdur.* Çəmənzəminli.

**MİF** [*yun.* mythos] 1. Allahlar, əfsanəvi qəhrəmanlar, dünyanın və həyatın əmələ gəlməsi haqqında qədim xalq rəvayətləri; əsatir.

2. *məc.* Fantastik, əfsanəvi, xəyali, əsli olmayan şey haqqında. *Həqiqət deyil, mifdir.*

**MİFİK** "Mif"dən *sif.* Əsatiri, əfsanəvi, mifoloji. *Mifik təsəvvürlər.*

**MİFOLOGİYA** [*yun.*] 1. Miflər, mifik rəvayətlər toplusu; əsatir. *Yunan mifologiyası.*

2. Mifləri tədqiq edən elm.

**MİFOLOJİ** *sif.* Mifologiyaya aid olan. *Mifoloji mövzu. Mifoloji qəhrəman.*

**MİFOLOQ** [*yun.*] Mifologiya mütəxəssisi.

**MİXBƏR** *is.* [*ərəbcədən*] Laboratoriya təcrübələrində işlədilən bir başı qapalı nazik şüşə boru; sınaq borusu. *Texnik süxur parçasını çini həvəngdə əzişdirib mixbər borusunu yarısına qədər doldurdu.* M.Süleymanov.

**MİXƏK** *is.* [*fars.*] Həmin adlı ağacın qurumuş qönçələrindən hazırlanan ətirli, tünd dadlı quru toz şəklində ədviyyə. *Xəmirə mixək qatmaq.* ☐ **Mixək, mixək ağacı** *bot.* – mərsin fəsiləsindən qönçələrindən mixək hazırlanan həmişəyaşıl ağac.

**MİXƏKGÜLÜ** *is. bot.* Xaççiçəklilər fəsiləsindən çox ətirli əlvan çiçəkli gül; maygülü, sədbər, şəbbu. [Balkonlarda] *ikinci cərgədə .. mixəkgülü, qərənfil, sabahgülü, qurdağzı əkilir.*

**MİXƏKKİMİLƏR** *cəm, bot.* Mixək ağacı, evkalipt və bəzi başqa bitkilərin daxil olduğu fəsilə. *Mixəkkimilər fəsiləsinin başlıca cinslərindən biri evkaliptdir.* M.Qasımov.

**MİXƏKLİ** *sif.* Mixək qatılmış, mixək tökülmüş, tərkibində mixək olan. *Mixəkli fətir.* – *Katibin Sübhanverdizadəyə ötən günü hilli, mixəkli çay verməyi indi onun başına böyük bir bəla açmış oldu.* S.Rəhimov.

**MİXƏYİ** *sif.* Mixək rəngində olan, mixək rənginə çalan; qəhvəyi. *Mixəyi parça. Mixəyi şal.* – *Dildar arvadın mixəyi sətin tumanı kürsüdən aşağı tökülüb çətir kimi qabarmışdı.* Ə.Vəliyev. *Qaratel sadə mixəyi don geyib, ala-bula ləçək bağlamışdı.* Ə.Əbülhəsən.

**MİXİ** *sif.* [*fars.*]: **mixi xətt (yazı)** – Qabaq Asiyanın qədim xalqlarında (Assuriyada, Babilistanda, qədim İranda) gil və ya daş üzərində mıxşəkilli cızıqlardan ibarət yazı üsulu. *Mixi əlifba. Bisutun mixi yazıları.* – *Ceyniz ən yaxşı tələbələrdən hesab olu-*

*nurdu, mixi xəttini də gözəlcə oxuyurdu.* Çəmənzəminli.

**MİKÁDO** Yaponiya imperatorunun titulu və bu titulu daşıyan şəxs.

**MİKNƏT** *is.* [*ər.*] *klas.* Güc, qüvvət, iqtidar, qüdrət. *İstərsən əgər oğlun edə kəsb fəvaid; Həm sərvəti zaid ola, həm miknəti zaid.* M.Ə.Sabir.

**MİKOZ** *is.* [*yun.*] İnsanda və başqa canlılarda çeşidli xəstəliklər yaradan parazit göbələklərin ümumi adı.

**mikro**... [*yun.* mikros – kiçik] Mürəkkəb sözlərin birinci tərkib hissəsi olub aşağıdakı mənaları ifadə edir: a) çox balaca, çox kiçik; məs.: mikroorqanizm; b) çox kiçik elementlərin və kəmiyyətlərin ölçülməsi və ya tədqiqi ilə əlaqədar olan; məs.: mikroanaliz, mikrobiologiya; c) sözün ikinci hissəsində verilən əsas ölçü vahidinin milyonda bir hissəsi; məs.: mikrovolt.

**MİKRÓB** [*yun.* mikros – kiçik və bios – həyat] Ancaq mikroskopla görünə bilən birhüceyrəli orqanizm; bakteriya.

**MİKROBİOLÓGİYA** [*yun.* mikros, bios və logos] Biologiyanın mikroorqanizmləri öyrənən bölməsi.

**MİKROBİOLÓJİ** *sif.* [*yun.*] Mikrobiologiyaya aid. *Mikrobioloji tədqiqat.*

**MİKROBİOLÓQ** [*yun.*] Mikrobiologiya mütəxəssisi.

**MİKROBSUZLAŞDIRMA** “Mikrobsuzlaşdırmaq”dan *f.is.*

**MİKROBSUZLAŞDIRMAQ** *f.* Mikroblarını məhv etmək, zərərsizləşdirmək, sterilizə etmək.

**MİKROELEMENTLƏR** [mikro... və *lat.* elementum] Bitki və heyvan orqanizmlərində çox az miqdarda (faizin yüzdə, mində biri və daha az) olan kimyəvi elementlər.

**MİKROFÓN** [mikro... və *yun.* phone – səs] Səs titrəyişlərini elektrik titrəyişlərinə çevirən cihaz (səsi uzaq məsafələrə vermək, yaxud gücləndirmək üçün tətbiq edilir).

**MİKROİQLİM** *is.* [mikro... və *ər.* iqlim] Kiçik sahənin, yerin xüsusiyyətlərindən (meşə, çöl, bataqlıq və s.-dən) asılı olan iqlimi.

**MİKROKLİMAT** [mikro... və klimatos] b a x **mikroiqlim**.

**MİKROQURULUŞ** *is. xüs.* Bərk maddələrin mikroskop altında görünən quruluşu.

**MİKRÓN** [*yun.* mikron – kiçik] Metrin milyonda bir hissəsi.

**MİKROÓRQANİZM** [mikro... və *yun.* organismus] Adi gözlə görünməyən bitki və ya heyvan orqanizmi.

**MİKRORAYÓN** [mikro... və *rus.* район] 1. Rayonun bölündüyü ən kiçik vahid.

2. Şəhər və iri qəsəbələrin ətrafında salınmış yaşayış məntəqəsi.

**MİKROSKÓP** [mikro... və *yun.* skopeo – baxıram] Adi gözlə görünməyən şeylərə baxmaq üçün çox böyüdücü şüşələr sistemi olan optik cihaz.

**MİKROSKOPİYA** [mikro... və *yun.* skopeo – baxıram] Mikroskopun quruluş və tətbiqini, həmçinin mikroskopik preparatların hazırlanma üsullarını öyrənən təcrübi fənn; bir şeyin mikroskop vasitəsilə öyrənilməsi.

**MİKROSKOPİK** *sif.* [*yun.*] 1. Mikroskop vasitəsilə edilən (görülən, aparılan). *Mikroskopik tədqiqat.*

2. Son dərəcə kiçik, ancaq mikroskopla görünən. *Mikroskopik cisimciklər.*

**MİKROTƏRƏZİ** *is.* [mikro... və *fars.* tərazu] Ən xırda şeyləri çəkmək üçün tərəzi.

**MİKSER** *is.* [*ing.*] Krem, kokteyl və s. düzəltmək üçün cihaz.

**MİQDAR** *is.* [*ər.*] 1. Say, qədər, kəmiyyət. *Hər şeyin miqdarı vardır.* □ **Bir miqdar** – bir qədər, bir az, qeyri-müəyyən qədər. [Molla İbrahimxəlil:] *..Molla Həmidin tərəfindən məlum oldu ki, siz, guya, bir miqdar pul gətirib gümüş almaq xahiş edirsiniz.* M.F.Axundzadə. **Nə miqdar** – nə qədər, nə dərəcədə, nə nisbətdə. *Heç bilməm kim, nə miqdar istər ol canparəsin.* Qövsi.

2. Hörmət, qədir-qiymət, etibar. [Hacı Nuru:] *Kamal ata kürkü deyil ki, irs ilə övlada yetişə. O səbəbdən xalq arasında miqdarın yoxdur.* M.F.Axundzadə.

**MİQDARCA** *zərf* Miqdara görə, sayca, kəmiyyətcə.

**MİQDARİ** *sif.* [*ər.*] Kəmiyyətə görə, kəmiyyətcə. *Miqdari analiz.*

**MİQDARSIZ** *sif.* 1. Saysız, hədsiz, çox, saysız-hesabsız.

2. Hörməti olmayan, qədir-qiymətsiz, hörmətsiz.

**MİQDARSIZLIQ** *is.* Saysızlıq, hesabsızlıq, hədsizlik.

**MİQNÁTİS** *is.* [*ər.* əsli *yun.*] *köhn.* Maqnit. *Ey dili-qafil, qız ki var, miqnatis kimi bir şeydir.* C.Cabbarlı.

**MİQRÉN** [*fr.*] Adətən başın bir yarısında bərk başağrısı təzahür edən əsəb xəstəliyi; parabaş. *..Demək olar ki, onun başı ağrısız olmazdı. Həkim miqren demişdi.* Ə.Əbülhəsən.

**MİQYAS** *is.* [*ər.*] 1. Çertyojda, planda, xəritədə və s.-də çəkilən xətlərin uzunluğunun yerin həqiqi uzunluğuna olan nisbəti.

2. Ölçü, dərəcə, dairə, bir şeyin qavrama dərəcəsi. *Bir nəfər oğlanın işi buraxıb qaçması istehsalata çox cüzi bir təsir göstərsə də, bunun daha geniş miqyasda zərəri ola bilərdi.* M.Hüseyn.

3. Ölçü aləti, məsafə ölçüsü.

**MİQYASLI** *sif.* 1. *xüs.* Müəyyən miqyasda olan (çertyoj, plan və ya xəritə haqqında). *Böyük miqyaslı xəritə.*

2. *məc.* Geniş, əhatəli, vüsətli. *Geniş miqyaslı əsər.*

**MİL**[1] *is.* [*ər.*] 1. Bəzi alətlərdə, mexanizmlərdə, maşınlarda ox, qol; ümumiyyətlə, müxtəlif işlərdə istifadə edilən nazik metal çubuq. *Çarx mili. Dəyirman mili. – Hesabdar çotka dənələrini tərpətdi, dənələr millərdə firlanaraq şıq-şıq şıqqıldadı.* S.Rəhimov. // Saat və s. mexanizmlərdə əqrəb. *Mina darıxdığından saatın milləri heç irəli getməyirdi.* İ.Musayev.

2. Corab və s. toxumaq üçün ucu küt, uzun iynə. *Səkinə .. milləri götürüb corab toxumaqla məşğul oldu.* M.İbrahimov.

3. Parçada zolaq, zol, xətt.

4. Evlərin üstündə qurulan taxtapuşların ən yuxarısında başdan-başa qoyulan uzun ağac, tir. *Damın mili.*

5. Əldə oynadılan bir ucu nazik, o biri ucu yoğun idman aləti. [Bir ayrısı:] *Paltarlarımızı tamam çıxardıb, sonra on-on beş girvənkə gələn milləri atıb-tutar, oynadardıq.* Çəmənzəminli.

6. Gözə sürmə çəkmək üçün sümükdən və s.-dən nazik alət; milçə. *Yar məni dindirir şirin dil ilə; Gözə sürmə çəkir gümüş mil ilə.* "Aşıq Qərib".

◊ **Mil qalmaq (durmaq, dayanmaq)** – düz durub əmr gözləmək. **Mil qalxmaq** – dik qalxmaq, dik durmaq.

**MİL**[2] [*ing.* mile] Müxtəlif ölkələrdə müxtəlif uzunluğa bərabər məsafə ölçüsü. □ **Coğrafi mil** – 7420 metr uzunluqda məsafə ölçüsü. **Dəniz mili** – 1852 metr uzunluğunda məsafə ölçüsü.

**MİLAD** *is.* [*ər.*] Xristianlarda: İsanın doğulduğu il. // Həmin ildən başlanan təqvim. *Miladın II əsrində. Miladdan əvvəl.*

**MİLADÍ** *sif.* [*ər.*] İsanın anadan olduğu gündən başlanan, hesablanan. *Miladi tarix. – Hicri tarixlə 1324-cü, miladi tarixlə 1906-cı ildə şah konstitusiyanın birinci hissəsini təsdiq etdi.* P.Makulu.

**MİLÇƏ** *is.* Kiçik mil, balaca mil. *Hüseyn əmi .. milçə ilə çubuğun başını qurdalayır və boğazını arıtlayırdı.* M.S.Ordubadi.

**MİLÇƏK** *is.* Bəzi yoluxucu xəstəlik mikroblarını yayan qoşaqanadlı həşərat, çibin. *Milçək bir şey deyil, könül bulandırır.* (Məsəl). *Dedi divanə: – Ey şəhi-məğrur; Mənə milçəklər eyləyir azar.* S.Ə.Şirvani.

◊ **Milçək vızıltısı qədər** – qətiyyən, əsla təsiri olmayan söz, səs və s. haqqında. *Nəzarətçinin bağırtısı milçək vızıltısı qədər də təsir eləmirdi.* M.Hüseyn. **Milçək qovmaq (tutmaq)** – avaralanmaq, heç bir işlə məşğul olmamaq, boş-bekar dayanmaq. **Milçək kimi vızıldamaq** – ara vermədən, eyni sözü dönə-dönə təkrarlamaq. *Akif əsəbi halda gəzinir. Süleyman onun dalına düşüb milçək kimi qulağının dibində vızıldayır.* M.İbrahimov. **Milçək uçsa eşidilər** – tam sakit, xamuş, səssiz yer haqqında. *Kimsə dinmir, milçək uçsa eşidərsən otaqda; Qonurgözlü bir uşaq da oturmuş bir bucaqda.* S.Rüstəm.

**MİLÇƏKQAPAN** *is. zool.* Ağacdələn dəstəsindən kiçik bir quş.

**MİLÇƏKQIRAN** *is.* 1. Milçəkləri qırmaq üçün üstü zəhərli və ya yapışqanlı kağız və s.

2. B a x **milçəkvuran**.

**MİLÇƏKLƏNMƏ** "Milçəklənmək"dən *f.is.*

**MİLÇƏKLƏNMƏK** *f.* 1. Quyruğu ilə və ya bədəninin hər hansı bir hərəkəti ilə üstünə, göz-başına qonan milçəkləri qovmaq (heyvanlar haqqında). *Çil at büdrədi, sonra ye-*

*rində sakit dayandı və gödək quyruğu ilə milçəkləndi.* S.Rəhimov. [Nəcəfalı:] *Ay Məhər, elə hər sözə şübhə eləməkdən, milçəklənən at kimi başını yırğalamaqdan başqa bir şey bilmirsən.* B.Bayramov.

2. *məc. dan.* Heç hərəkət etməmək, qətiyyən tərpənməmək, qımıldanmamaq.

**MİLÇƏKTUTAN** *is.* 1. *bot.* Şehçiçəyi fəsiləsindən həşərat yeyən bitki; sinəkqapan.

2. *zool.* Sərçə fəsiləsindən həşərat yeyən müxtəlif quşların adı.

**MİLÇƏKVURAN** *is.* Milçəkləri vurub öldürmək üçün dəstəkli alət.

**MİLÇƏKYEYƏN** *is. zool.* Sürfələrini milçəklə bəsləyən həşərat.

**MİLEDİ** *is.* [*fr.*] İngiltərədə imtiyazlı sinifdən olan ərli qadına müraciət forması.

**MİLENİUM** *is.* [*lat.*] Min ilə bərabər zaman vahidi. *Üçüncü milenium başladı.*

**MİLƏL** *is.* [*ər.* "millət" söz. cəmi] Millətlər. *Sair miləl övrətlə ədalət edir, etsin.* M.Ə.Sabir. *Sair miləl və əqvam artıq sürətlə irəli gedib özləri üçün ixtiyarlar və imtiyazlar axtarmaqdadırlar.* F.Köçərli.

**MİLƏMİL** *sif.* Milləri olan, zol-zol, zolaq-zolaq. *Miləmil çit. Miləmil parça.* – [Tahir] *stuldan asılmış miləmil yay kostyumunu geyindi.* M.Hüseyn.

**MİLİS** [*lat.* militia – ordu] *köhn.* 1. B a x **milisioner**. *Kapitan iki milislə daxil olur.* İ.Əfəndiyev. ◻ **Milis nəfəri** – b a x **milisioner**. *Milis nəfərinə müraciət etmək.*

2. B a x **milisiya**. *Qəlbində bir nəcib atalıq hissi; Uğur olsun! – dedi milis rəisi.* S.Rüstəm.

**MİLİSİONER** [*lat.*] *köhn.* Milis işçisi, milisiyada xidmət edən adam, milis nəfəri. *Milisioneri köməyə çağırmaq. – Yoldaş milisioner, axşamınız xeyr! Ən köhnə dostunam bu şəhərdən mən.* S.Rüstəm. *Abbas on beş ildən artıq milisioner işlədi.* Ə.Vəliyev.

**MİLİSİONERLİK** *is.* Milisioner vəzifəsi, işi. *Milisionerlik eləmək.*

**MİLİSİYA** [*lat.* militia – ordu] *köhn.* 1. İctimai asayişi və əmniyyəti qoruyan inzibati orqan. // *dan.* Bu orqanın yerli idarəsi. *Milisiyada qeydə alınmaq.*

2. *top.* Milis işçiləri, milisionerlər. *Bütün milisiya yığıldı.*

**MİLİTARİST** [*lat.* militaris – hərbi] Militarizm siyasəti yeridən; hərbçi.

**MİLİTARİZM** [*lat.*] 1. İmperialist dövlətlərin silahlanma və müharibəyə hazırlanmaqdan ibarət mürtəce siyasəti; hərbçilik.

2. Hərbçilərin siyasi hakimiyyəti.

**MİLLƏMƏ** 1. "Milləmək"dən *f. is.*

2. *zərf* Mil kimi, düz, dik. *Milləmə qalxmaq.*

**MİLLƏMƏK** *f.* Mil kimi düz, dik qaldırmaq, durğuzmaq.

**MİLLƏNMƏ** "Millənmək"dən *f.is.*

**MİLLƏNMƏK** *f.* Dik qalxmaq, düz qalxmaq, dikəlmək. *Quşlar havaya millənib, dənizə doğru uçub getdilər.* M.Rzaquluzadə. *Şiferli damlardan qalxan boz tüstülər küləksiz havada yuxarı millənir, göyün bir qatında əriyib yox olurdu.* B.Bayramov.

**MİLLƏT** *is.* [*ər.*] 1. İnsanların tarixən dil, ərazi, iqtisadi həyat və psixika ümumiliyi əsasında təşəkkül tapan və milli xarakterin mədəniyyətin milli özünəməxsusluğunda təzahür edən sabit birliyi.

2. Dövlət, ölkə mənasında. *Birləşmiş Millətlər Təşkilatı.*

**MİLLƏTÇİ** *is.* və *sif.* Millətçilik tərəfdarı (b a x **millətçilik**). *Millətçi partiyalar.*

**MİLLƏTÇİLİK** *is.* Milli əlahiddəlik və müstəsnalığı, digər millətlərə etimadsızlığı təbliğ edən ideologiya və siyasət.

**MİLLƏTPƏRƏST** [*ər.* millət və *fars.* ...pərəst] b a x **millətçi**. [Rüstəm bəy:] *Birisi millətpərəst Həsənqulu bəydir ki, sən onu tanıyırsan.* Ü.Hacıbəyov.

**MİLLƏTPƏRƏSTLİK** b a x **millətçilik**.

**MİLLƏTPƏRVƏR** *is.* və *sif.* [*ər.* millət və *fars.* ...pərvər] Millətini, xalqını sevən, istəyən, millətinə, xalqına məhəbbəti olan; milli azadlıq hərəkatı tərəfdarı, iştirakçısı. *..Bu iki millətpərvər bir məsləkdə olub öz millətlərinin səadətinə çalışırdılar.* İ.Musabəyov.

**MİLLƏTPƏRVƏRLİK** *is.* Millətini, xalqını sevmə, istəmə; millətinə, xalqına məhəbbəti olma.

**MİLLİ**[1] *sif.* [*ər.*] 1. Millətə aid olan, millətə məxsus olan. *Milli məsələ. Milli hərəkat.* – [Səttarxan:] *Möhtərəm natiq, əsil məsələ yalnız torpaq və suda deyil, mübarizə milli azadlıq uğrundadır.* M.S.Ordubadi. ◻ **Milli**

**azadlıq hərəkatı** – vətənlərini, xalqını xarici əsarətdən azad etmək uğrunda xalqların apardığı milli mübarizə.

2. Hər hansı millətin səciyyəvi xüsusiyyətlərini ifadə edən, hər hansı millətə xas olan. *Milli mədəniyyət. Milli adətlər. Milli musiqi. Milli geyimlər.*

3. Bir ölkəyə, dövlətə aid olan. *Milli bayraq. Milli himn.*

4. Ayrıca, kiçik millətə (xalqa) aid olan. *Milli rayon.*

**MİLLİ²** *sif.* 1. Üzərində milləri olan, zol-zol, zolaqlı, mil-mil, miləmil. *Milli parça.* – [Tahirin] *ağ milli, qəhvəyi kostyumuna söz ola bilməz.* M.Hüseyn.

2. Cızıqlı, üzərinə xətlər, cızıqlar çəkilmiş, milləri olan. *Milli kağız.*

**milli**... [*lat.* – mille – "min"dən] Mürəkkəb sözlərin birinci tərkib hissəsi olub, əsas ölçü vahidinin mində birini göstərir; məs.: millimetr, milliqram, milliamper.

**MİLLİK** Adətən saylara qoşularaq, məsafənin neçə mil olduğunu göstərir.

**MİLLİQRÁM** [milli... və *yun.* gramma] Qramın mində bir hissəsi.

**MİLLİLƏŞDİRİLMƏ** "Milliləşdirilmək"-dən *f.is. Neft sənayesinin milliləşdirilməsi haqqında iyunun 2-də verilən Dekret Bakıda mühüm bir hadisə kimi qarşılandı.* M.S.Ordubadi.

**MİLLİLƏŞDİRİLMƏK** *məch.* Xüsusi mülkiyyətdən çıxarıb dövlətin ixtiyarına verilmək. *Dəmir yolları milliləşdirildi.*

**MİLLİLƏŞDİRMƏ** "Milliləşdirmək"dən *f.is.*

**MİLLİLƏŞDİRMƏK** *f.* 1. Xüsusi sahibkarların əlindən alıb, hökumətin ixtiyarına vermək. *İstehsal vasitələrini milliləşdirmək.* – *İran hökuməti xalqın haqlı tələbi ilə neft sənayesini milliləşdirmişdir.* M.Rzaquluzadə.

2. Milli səciyyə vermək.

**MİLLİLƏŞMƏ** "Milliləşmək"dən *f.is.*

**MİLLİLƏŞMƏK** *f.* 1. Xüsusi sahibkarların əlindən çıxıb hökumət ixtiyarına keçmək. *Şəhər nəqliyyatı milliləşdi.* – *Birkərəlik* [Hacı Sultanın] *evləri milliləşdi.* S.Hüseyn.

2. Milli səciyyə almaq.

**MİLLİLİK** *is.* Milli xüsusiyyət daşıma, milli səciyyədə olma.

**MİLLİMÉTR** [milli... və *yun.* metron] Metrin mində bir hissəsi.

**MİLLİMETRLİK** *sif.* Bir millimetr ölçüsündə.

◊ **Millimetrlik kağız** – bir millimetr ölçüsündə kvadratları olan çertyoj kağızı.

**MİLLİYYƏ** [*ər.*] *klas.* b a x **milli¹** 1 və 3-cü mənalarda. *Söylə mənə: vəzarəti-milliyyəniz düzəldimi?* M.Ə.Sabir.

**MİLLİYYƏT** *is.* [*ər.*] 1. Müəyyən millətə, xalqa mənsub olma, milli mənsubiyyət. *Milliyyəti azərbaycanlıdır.* – *Bu adamların yaşları, milliyyəti, harada yaşadıqları, məşğuliyyəti haqqında heç bir məlumat yox idi.* H.Seyidbəyli.

2. B a x **millət** 1-ci mənada.

**MİL-MİL** b a x **miləmil**. *Mil-mil çit.* – [Maya] *mil-mil göy adyalı üstünə çəkdi.* M.İbrahimov. *İkram mil-mil sətin köynəyinin yaxasını düymələmişdi.* Ə.Əbülhəsən.

**MİLORD** *is.* [*fr.*] 1. İngilis lordu.

2. Varlı adam.

**MİLYÁRD** [*fr.* milliard] 1.000.000.000 sayı. // 1.000.000.000 miqdarında. *İki milyard manat.*

**MİLYARDÇI** b a x **milyarder**.

**MİLYARDÉR** [*fr.* milliardaire] Dövləti, varı milyard, milyardlarla olan. *Amerika milyarderləri.*

**MİLYÓN** [*fr.* million] 1. 1.000.000 sayı. // 1.000.000 miqdarında.

2. Son dərəcə çoxlu miqdar, sayı-hesabı olmayan miqdar (bu mənada əsasən cəmdə işlənir). // Çoxlu pul, dövlət haqqında. [İbn Yəmin:] *Keyfə sərf eylədim də milyonlar; Yenə dövlətcə etibarım var.* H.Cavid. // Çoxlu adam, kütlə haqqında. *Milyonların gücünü bir məqsədə yönəltdin; İşıq verdin gözünə, qüvvət oldun qoluna.* R.Rza. *Sabir təkbaşına arzularından; Yazdı milyonların dərdinə dərman!* B.Vahabzadə.

**milyon-milyon** b a x **milyonlarca**. *Sayımız ölkədə milyon-milyon.* M.Müşfiq. *Milyon-milyon insanların şirin dilləri; Deyir bu gün; Milyon alqış Əlcəzairə!* S.Rüstəm.

**MİLYONÇU** b a x **milyoner**. *Milyonçu təyyarəçi.* – *Qış fəsli nə qədər gözəl olsa da, yenə bahar fəslinə bərəkət! O səbəbə ki, baharda ot bitir və acların dəxi Bakı milyonçularına*

*ehtiyacı olmur*. C.Məmmədquluzadə. *Mən sənə dövlət və sərvətin cəhətinə övrət olmazdım, zira İranda başqa milyonçular da çoxdur.* M.S.Ordubadi.

**MİLYONÉR** [*fr.* millionnaire] 1. Dövləti, varı milyon, milyonlarla olan. [Əhməd atasına:] *Sənin üstündə Nağının oğlu gəldi, milyoner oldu*. Ə.Haqverdiyev. *Bu da bizim milyonerlərimiz!* S.Rəhman.

2. *köhn.* Gəliri milyon və ya bir neçə milyon manat olan kolxoz haqqında.

3. Milyon və ya bir neçə milyon kilometr məsafə uçmuş təyyarəçi haqqında.

**MİLYONLARLA, MİLYONLARCA** *sif.* və *zərf* Sayı milyonlarla olan; milyon-milyon. *Qərinələrlə millətimizin şirin, canına milyonlarca ac mikroblar daraşıb qanını sormaqdadır.* C.Məmmədquluzadə. [İsmayılzadə:] *Ancaq milyonlarca xərc çəkmək istəyən adamın nə isə bir qarantiyası olmalıdır, deyilmi?* M.Hüseyn.

**MİM** [*ər.*] Ərəb əlifbasında "م" şəklində yazılan "m" hərfinin adı.

**MİMİK** [*yun.* mimikos] b a x **mimikaçı**. *Mimik aktyor.*

**MİMİKÁ** [*yun.* mimikos] 1. Üz əzələlərinin insanın keçirdiyi əhval-ruhiyyəni əks etdirən hərəkəti. [Muradlı] *tələbələrin bu qeydindən utandısa da, mimikasını dəyişmədi*. Mir Cəlal.

2. Üz əzələlərinin müvafiq hərəkəti ilə daxili hiss və həyəcanı ifadə etmək bacarığı.

**MİMİKAÇI** *is.* 1. Yaxşı mimikası olan artist, mahir mimik.

2. Mimik səhnələrdə çıxış edən artist.

**MİMÓZA** [*yun.* mimos – öz simasını dəyişən] b a x **küsdümağacı**.

**MİN** *say*. 1. Doqquz yüz doxsan doqquzdan sonra gələn ədəd, say – 1000. *Min manat. Min nəfər*. // Başqa saylarla birlikdə. *Beş min kilo. İki min altı yüz adam. – Min doqquz yüz səkkizinci ilin ilk günləri çox soyuq keçirdi.* M.Hüseyn.

2. Çoxlu, külli miqdarda, hədsiz, saysız-hesabsız. *Çöllər yuxudan olunca bidar; Min rəng çiçəklə doldu gülzar.* A.Şaiq. *Pəncərəsi ipək pərdəli evlərdə min təlaş var; min həşir.* R.Rza.

◊ **Min bir** – çox, hədsiz. *Min bir xəbər verir dünyadan bizə; Üstünü toz almış qalın kitablar.* S.Vurğun. *Min bir əməl arxasınca qoşmağı; Dürlü-dürlü ürəklərdən öyrəndim*. M.Müşfiq. *Min bir iztirab ilə keçən bir neçə saatda Əkbərin ürəyinə nələr gəlmədi?* Mir Cəlal. **Min cür, min cürə** – çox, çoxlu, hədsiz, hədsiz-hesabsız, saysız. [Qarı:] *Bağça desən, bağban desən var burda; Cana min cür dərman desən var burda.* "Aşıq Qərib". [Tapdıq] *hər şeyə etiraz edir, hər sözə qulp qoyur, min cürə şıltaqlıq göstərirdi.* Ə.Vəliyev. **Min dərədən su götürmək** – çox yerlərə baş vurmaq, çox şeydən danışmaq. *Bir qrup adamlar da vardır ki, peşmansan bir söz sorasan, sənə cavab verincəyə qədər min dərədən su götürür.* Qantəmir. **Min yaşa!** – çox yaşa! var ol! Ömrün uzun olsun! (*alqış ifadəsi*). **Min yaşamaq** – uzun ömür sürmək, çox yaşamaq. [Kosa:] *..Bircə bu kələkdən də çıxsaydım, yəqin min yaşardım.* S.Rəhimov. **Mində bir** – çox az təsadüf olunan, az-az rast gəlinən. **Mindən biri** – çox az, cüzi hissə. *Sinədə yaralərim saydı, dedi, min, cərrah; Səhv edib, bu hələ mindən birinin sayı deyil.* S.Ə.Şirvani.

**min-min** *zərf* və *sif.* Minlərcə, minlərlə sayılacaq qədər, son dərəcə çox, çoxlu. *..Atasından sonra köməksiz qalmağı və oxumağa məhəbbəti Bahadırı min-min fikirlərə salıb, bilmir idi ki, nə etsin.* N.Nərimanov. *Aydan işıqlıdır, gündən mənalı; Odur ilhamçısı min-min zəfərin.* H.Arif.

**MİNÁ** *is.* [*fars.*] 1. Metal və s. şeylərin üzərinə çəkilən rəngli şüşəvari təbəqə, çox incə və parlaq naxış. [Kəmərin] *üstü bu qədər qiymətli deyildi, mina ilə işlənmişdi.* M.S.Ordubadi. // Üzərinə mina ilə naxışlar çəkilmiş, minalı. *Mina qab. Mina güldan. – Əlim qoydum əl üstə; Mina kəmər bel üstə; Bu gün yarım gələcək; Gedim, durum yol üstə.* (Bayatı). *Mina kuzənin altına çiçəklər və yarpaqlar döşənmişdi, yanında büllur qədəh, dürlü məzələr və çərəzlər vardı*. Çəmənzəminli.

2. *məc.* Mina kimi parlaq, gözəl (obrazlı təşbehlərdə işlənir). *Bəstəboylu, mina gərdənli; Zülfü siyah, var əndamı ağ ola.* M.P.Vaqif. *Zülfü şahmar, mina gərdən mötədil; Zəbərcəd gəlməli, misali-bülbül*. Aşıq Ələsgər.

3. Dişi örtən parlaq, möhkəm maddə, qabıq. *Dişin minası.*

**MİNA** [*fr.*] 1. Adətən torpağın, suyun səthinə və ya altına qoyulan, partladıcı maddəsi olan mərmi. *Mina düzmək. Tanka qarşı mina. – Mərmi və mina ilə dağım-dağım olan yerin bağrından .. tüstülər qalxırdı.* Ə.Əbülhəsən. ◻ **Mina gəmisi** – güclü torpeda ilə silahlanmış hərbi gəmi.

2. Minomyot mərmisi. [Top] *gurultularının, pulemyot və mina səslərinin ardı-arası kəsilmir.* Ə.Vəliyev.

3. B a x **torpeda**.

**MİNAAXTARAN** *is. xüs.* Basdırılmış minaları tapmaq üçün cihaz, aparat.

**MİNAATAN** *is.* Mina atan silah-top; minomyot.

**MİNACAT** *is.* [*ər.*] *köhn.* 1. *din.* Allaha dua və səna etmə; dua-niyaz. [Ay:] *Mən Həzrət Musanın Turda minacatlarını eşitmişəm.* Ə.Haqverdiyev.

2. Klassik Şərq ədəbiyyatında Allaha xitabən dua və niyaz mahiyyətli şeir. *Dərviş nə minacat isə başladı.* A.Divanbəyoğlu.

3. Azan çəkməklə əhaliyə verilən xəbər; car. *Sübh olcaq çavuşun minacatı kəndi əhatə eləyib, gah o məhəllədən səsi gəlir, gah bu məhəllədən.* C.Məmmədquluzadə. *Minacat səsinin təsiri altında Həsən gözlərini qaldırıb göydəki ulduzlara tamaşa etdi.* B.Talıblı.

**MİNÁÇI** *is.* Qiymətli metaldan düzəldilmiş şeylərin üzünə mina ilə naxışlar çəkən, mina vuran, sənətkar; minasaz.

**MİNAÇI** *is. xüs.* Mina düzmə və ya düzülmüş minaları çıxarıb zərərsizləşdirmə mütəxəssisi.

**MİNAÇİÇƏYİ** b a x **minagülü**.

**MİNADÜZƏN** *is.* Dəniz yollarını minalayan hərbi gəmi və ya təyyarə.

**MİNAGÜLÜ** *is. bot.* Yerdən çox qalxmayan, gözəl, parlaq, göy rəngli gül.

**MİNALAMA** "Minalamaq"dan *f.is.*

**MİNALAMAQ** *f.* Mina ilə naxışlamaq, bəzəmək, üzərinə mina çəkmək. *Gümüş kəməri minalamaq. Xəncər dəstəsini minalamaq.*

**MİNALAMAQ** *f.* Bir şeyi partlatmaq üçün altına mina qoymaq, mina düzmək, mina basdırmaq. *Hər iki yoldaş təmkin və səbirlə körpünü minalayıb qurtardıqdan sonra həmin yolla da sürünə-sürünə geri qayıtdılar.* M.Hüseyn. *Bələdçinin biri xəbər gətirdi ki, məftil hasarın bir kilometrliyini düşmən minalamışdır.* Ə.Vəliyev.

**MİNALANMA** "Minalanmaq"dan *f.is.*

**MİNALANMAQ** *məch.* Mina ilə naxışlanmaq, mina vurulmaq.

**MİNALANMAQ** *məch.* Partladılmaq üçün altına mina qoyulmaq, mina düzülmək, mina basdırılmaq. *Yol minalanıbdır.*

**MİNALANMIŞ** *f.sif.* Üzərinə mina çəkilmiş, mina ilə naxışlanmış (bəzədilmiş), mina vurulmuş; minalı. *Minalanmış kəmər. Minalanmış qolbaq.*

**MİNALANMIŞ** *f.sif.* Mina basdırılmış, mina düzülmüş; minalı. *Minalanmış sahə.*

**MİNÁLI** *sif.* Mina vurulmuş, üzərinə mina çəkilmiş, mina ilə bəzədilmiş, minalanmış. *Birinin döşündə sapa düzülmüş kəhrəba danələri və birinin qulağından minalı qızıl sırğalar asılırdı..* C.Məmmədquluzadə. *Cüft ilə alınmış brilyant sırğa; Minalı bilərzik, almazlı cıqqa.* H.K.Sanılı.

**MİNALI** *sif.* Altına mina qoyulmuş, mina düzülmüş; minalanmış. *Minalı sahə.*

**MİNARƏ** *is.* [*ər.*] Azan vermək üçün məscidlərin yanında və ya üstündə ucalan qüllə. [Molla Kazım:] *Azançı Məşədi Səlimə deyin, çıxsın minarədə minacat çəksin.* Ə.Haqverdiyev. *Sübh açıla-açılmaya məscidlərin minarələrindən sübh azanının səsi eşidilərdi.* H.Sarabski. *Dürrə .. göylərə ucalan minarələrin yanındakı kiçik bir daxmaya yetişdi.* S.Vəliyev.

**MİNARƏLİ** *sif.* Minarəsi olan. *Minarəli məscid.*

**MİNASAÇAN** b a x **minaatan**. *Düşmən .. top və minasaçan atəşini əsirgəmirdi.* Ə.Əbülhəsən.

**MİNASAZ** [*fars.*] b a x **minaçı**.

**MİNASAZLIQ** *is.* Mina ilə naxışvurma sənəti. *Minasazlıq Azərbaycanda zərgərlik sənətinin mühüm sahələrindən biridir.*

**MİNBAŞI** *is. köhn.* Türkiyə və İranda yüzbaşıdan sonra gələn zabit rütbəsi. [Ağa Kərim xan:] *Sərbazlar gəlin, minbaşılar gəlin, pulum tapılmasa, bu boğazımdan özümü asacağam.* N.Vəzirov.

**MİNBƏR** *is.* [*ər.*] Məscidlərdə: vaizin, xətibin çıxıb vəz, xütbə oxuduğu pilləli kürsü. [Yaşlı kişi:] *Şeyx Yəhya minbərə qalxıb moizəsini başladı.* S.Hüseyn. [Axund:] *Məscidə, minbərə, üləmaya .. etiqad xeyli zəifləyib.* Mir Cəlal.

**MİNCƏ** *sif.* Ancaq min, yalnız min. *Mincə manat pul.* // Bəzən təyin etdiyi sözə böyüdücülük çaları verir. *Niyə bəyənmirsən, mincə manat pul vermişəm.*

**MİNDİLLİ** *sif.* Yalançı.

**MİNDİRİLMƏ** "Mindirilmək"dən *f.is.*

**MİNDİRİLMƏK** *məch.* 1. Oturdulmaq, əyləşdirilmək (miniyə). *Vaqona mindirilmək. Ata mindirilmək.*

2. Yerləşdirilmək, üstünə qoyulmaq. *Dəyirmi dəyirman daşı yavaş-yavaş yerindən tərpədildi və sürütmənin üstünə mindirildi.* S.Rəhimov.

**MİNDİRMƏ** "Mindirmək"dən *f.is.*

**MİNDİRMƏK** *f.* 1. Oturtmaq, əyləşdirmək (miniyə). *Təyyarəyə mindirmək. Arabaya mindirmək. – ..Yusif Sərracı mindirdilər ata..* M.F.Axundzadə. [Telli:] [Gəlini] *yaxşıca geyindirirlər, bəzəyirlər, sonra faytona mindirib Allah-Allah ilə aparırlar.* Ü.Hacıbəyov.

2. Üstünə qoymaq, yerləşdirmək.

3. Keçirmək, yerinə salmaq, qoymaq. *Bunu fikirləşib Koroğlu oxu mindirdi çilləyi-kəmanə, başçı durnaya bir ox atdı.* "Koroğlu".

**MİNERÁL** [*fr.* mineral] 1. Yer qabığının tərkibinə daxil olan və faydalı qazıntı kimi istifadə edilən təbii kimyəvi birləşmə və ya element. *Təbiətdə faydalı qazıntılara ya ayrı-ayrı minerallar, ya da bir mineraldan ibarət olan süxurlar şəklində təsadüf edilir.* M.Qaşqay.

2. *Sif. mənasında.* Mineral olan, mineraldan ibarət olan, yaxud tərkibində mineral olan. *Mineral maddələr. Mineral gübrələr. Badamlı mineral suyu.*

**MİNERALLAŞDIRILMA** "Minerallaşdırılmaq"dan *f.is.*

**MİNERALLAŞDIRILMAQ** *məch.* 1. Mineral birləşmələrə çevrilmək (üzvi maddələr haqqında).

2. Mineral duzlarla doydurulmaq.

**MİNERALLAŞDIRMA** "Minerallaşdırmaq"dan *f.is.*

**MİNERALLAŞDIRMAQ** *f.* 1. Üzvi maddələri minerala və ya mineral birləşmələrə çevirmək (üzvi maddələr haqqında).

2. Mineral duzlarla doydurmaq.

**MİNERALLAŞMA** 1. "Minerallaşmaq"dan *f.is.*

2. Üzvi maddələrin minerala, mineral birləşmələrə çevrilməsi. *Bitkilərin minerallaşması.*

3. Bir şeyin mineral duzlarla doyması. *Suyun minerallaşma dərəcəsi. Torpağın minerallaşma prosesi.*

**MİNERALLAŞMAQ** *f.* Minerala, mineral birləşməyə çevrilmək (üzvi maddələr haqqında).

**MİNERALÓGİYA** [*fr.* mineral və *yun.* logos] Minerallardan bəhs edən elm.

**MİNERALOJİ** *sif.* Mineralogiyaya aid olan, mineralogiya ilə əlaqədar olan. *Mineraloji xüsusiyyət. Mineraloji tərkib.*

**MİNERALÓQ** [*fr.* mineral və *yun.* logos] Mineralogiya mütəxəssisi.

**MİNİATÜR** [*ital.* miniatura, əsli *lat.*] 1. Qədim əlyazmalarında, kitablarda incə, rəngli şəkil və ya bəzəkli iri hərf (yazı). "*Xəmsə*"*nin miniatürləri.*

2. Zərif işlənmiş kiçik rəsm, şəkil. [Ərknaz] *Şərq miniatürlərində gördüyümüz qələmqaş, incəbel gözəllərə oxşayırdı.* M.Hüseyn. [Şümşad xanım] *qədim Şərq nəqqaşlarının çəkdiyi saysız miniatürlərdən birini xatırladırdı.* Ə.Sadıq.

3. Kiçik ədəbi və ya musiqi əsəri. *Yazıçının miniatürləri.*

4. Kiçik və incə (zərif). *Miniatür model. – Yaşıl məhəccərli dördkünc bağçada Nizaminin tuncdan tökülmüş miniatür heykəli qoyulmuşdu.* M.Hüseyn.

**MİNİATÜRÇÜ** *is.* Miniatür rəssamı.

**MİNİATÜRLÜK** *is.* İncəlik, zəriflik, kiçiklik, balacalıq.

**MİNİCİ**[1] *is.* At minən, ata minib gedən; süvari. *At minicisini tanıyar.* (Ata. sözü). *At naşı minicini üstündə saxlamaq istəmirdi.* M.İbrahimov. // Mahir at minən adam, mahir at sürücüsü, yaxşı süvari. *Kəndin lap məşhur miniciləri yığışdılar.* "M.N.lətif." *Ağlibas özgə bir minici; Vurdu məhmiz, o da at oynatdı.* A.Səhhət. *Qara oğlan .. özünü gələcəkdə*

*böyük bir minici və atıcılardan hesab edirdi.* S.Rəhimov.

**MİNİCİ²** *is. zool.* Bitkilərə zərərverici bir cücü. *..Pambıq, taxıl, bağ və bostana zərər verən cücülərdən nümunə olaraq pambıq sovkasını, minicini, faydalı cücülərdən isə bal arısını, ipəkqurdunu və s. göstərmək olar.* C.Cəbrayılbəyli.

**MİNİCİLİK** *is.* Mahir at minmə bacarığı. [İlyas:] *Tərlan kimi coşqun məzaclı bir köhləni isə yalnız minicilik sənətkarlığının zirvəsində duran tək-tək adamlar minə bilirdi.* Ə.Məmmədxanlı.

**MİNİK** *is.* 1. Bir yerə getmək üçün nəqliyyat vasitələrinin birinə minmiş adam. *Ancaq tək-tük üstüörtülü faytonlar içində miniklər görünür.* S.M.Qənizadə. *İkinci zəng vurulduqda miniklər vaqonlara minməyə başladılar.* B.Talıblı.

2. Nəqliyyat vasitələrindən hər hansı biri. *Bu halda yengələri miniyindən düşürüb gəlinin yanına aparardılar.* R.Əfəndiyev. *Qatardan düşən adamlar durub minik gözləyirdilər.* S.Vəliyev.

3. Sərnişin daşımağa məxsus, sərnişinlərə xidmət edən. *..Minik atından da artıq qoşqu atını mən xeyli dost tutaram.* C.Məmmədquluzadə. *Hər cür minik və yük maşınları arasıkəsilmədən o tərəf-bu tərəfə hərəkət edirdi.* M.İbrahimov. *Minik qatarı uzaqlaşdı.* Mir Cəlal.

4. Minmə işi, miniş. *Saat 4-də minik başlandı. Minik qurtaran kimi avtobus yerindən tərpəndi.*

**MİNİLLİK** 1. *sif.* Min il müddətində olan, min il davam etmiş. *Minillik ədəbiyyat.*

2. *is.* Min ildən ibarət zaman, dövr. *Vaxt hesabında hər on il – bir onillikdən, hər yüz il – bir əsrdən, hər min il – bir minillikdən ibarətdir.* "Qədim dünya tarixi".

**MİNİLMƏ** "Minilmək"dən *f.is.*

**MİNİLMƏK** "Minmək"dən *məch. Yaxşı atdır bədöv at; Minilməyə bədöv at; İgidi cavan saxlar; Əsil arvad, bədöv at.* (Bayatı).

**MİNİMÁL** *sif.* [*lat.*] Başqaları sırasında ən kiçik, ən az, ən xırda (*maksimal* əksi). *Minimal miqdar. Minimal dərəcə. Minimal gərginlik.*

**MİNİ-MİNİ** *sif. oxş.* Kiçicik, xırdaca. *Uşağın mini-mini ağzı. – ..Azad və asudə yaşayaraq mini-mini balaları oxudardım.* T.Ş.Simurq.

**MİNİMUM** [*lat.*] 1. Ən kiçik miqdar, ən az miqdar (*maksimum* əksi). *Minimum temperatur.*

2. Hər hansı bir sahədə lazım olan bilik və ya tədbirlərin məcmusu. *Texniki minimum. Namizədlik minimumu.*

**MİNİNCİ** *sıra s.* Doqquz yüz doxsan doqquzuncudan sonra gələn say. *Mininci səhifə.*

**MİNİŞ** *is.* Minmə, minmə tərzi.

**MİNİŞMƏ** "Minişmək"dən *f.is.*

**MİNİŞMƏK** *qarş.* Bir vaxtda, birgə miniyə oturmaq, yaxud bir-birini basaraq, itələyərək minmək. *Minişdilər ata, çərkəzlər oldular qıvraq.* A.Səhhət. *Gəlini molla dualayandan sonra faytona minişərdilər.* R.Əfəndiyev.

**MİNQRELLƏR** *cəm* Qərbi Gürcüstanda yaşayan, keçmişdə ayrıca etnik qrup təşkil edən gürcülər.

**MİNLƏRLƏ, MİNLƏRCƏ** *sif.* Sayı minlərlə olan (bir şeyin sayca çoxluğunu bildirir). *Minlərcə adam. – Kəndin qabağındakı çayaşağıda elə bil minlərcə adam səs-səsə verib car çəkirdi.* Ə.Vəliyev. *Minlərlə gənclər kitab üçün axışıb gəlirlər.* Mir Cəlal.

**MİNLİK** *sif.* Min vahidlə ölçülən. *Minlik lampa.*

**MİNMƏ** "Minmək"dən *f.is.*

**MİNMƏK** *f.* 1. At və ya başqa minik heyvanının üstünə qalxmaq, oturmaq. *At minib cıdıra çıxmaq, tüfəng atmaq.* [Kiçikbəyim] *üçün təbii bir ehtiyac kimi idi.* Çəmənzəminli. *O yanaşdı dəvəyə; Ancaq minə bilmədi.* B.Vahabzadə. // Bir yerə getmək üçün nəqliyyat vasitələrindən birinə oturmaq. *Təyyarəyə minmək.*

2. Oturmaq, əyləşmək. *Tapdıq atasını görən kimi anasının belindən düşüb atasının qucağına mindi.* Ə.Vəliyev. *Əziz artıq pul sərf edib özgə maşınına xəlvət minməyi sevməzdi.* S.Rəhman.

3. Bir sıra isimlərdən sonra gətirilərək mürəkkəb feil və müxtəlif ifadələr düzəldilir; məs.: dalına minmək, qiymətə minmək və s.

**MİNNƏT** *is.* [*ər.*] Edilən hörmət və yaxşılığa qarşı daxilən duyulan borcluluq hissi, özünü borclu bilmə.

◊ **Minnət çəkmək** – 1) hörmət və yaxşılıq qarşısında özünü borclu bilmək. [Xoca Əziz:] *İgid də igiddən çəkərmi minnət!* "Koroğlu"; 2) b a x **minnət götürmək**. [Xanpəri:] *Nə lazımdır ki, Hətəm xan ağadan və ya özgəsindən minnət çəkəsən.* M.F.Axundzadə. [Səməndər] *qonaqlarını heç kəsdən minnət çəkmədən yedirib-içirib yola sala bilərdi.* B.Bayramov. **Minnət etmək (eyləmək)** – təvəqqe etmək, xahiş etmək, boyun əyib yalvarmaq. *Adamlar yerbəyerdən xana minnət elədilər*. "Qurbani". *Ey yığılan canlar, minnət eyləyin; Dursun o gözəllər şahı, oynasın*. Q.Zakir. **Minnət götürmək** – edilən hörmətin, yaxşılığın və ya bəxşişin qarşısında özünü borclu bilmək. [Hacı Saleh:] *Boynuma torba salıb dilənməyə hazıram, nəinki sənin kimi adamdan minnət götürməyə*. S.S.Axundov. **Minnət götürməmək** – məqsəd güdən yaxşılığı və s. qəbul etməmək, ondan imtina etmək. *O heç kəsdən minnət götürməz. – Sən indiyədək heç kəsdən minnət götürməyibsən.* Ə.Haqverdiyev. **Minnət qoymaq** – etdiyi hörmət və yaxşılığı başa qaxmaq, xatırlatmaq, başqasını özünə borclu çıxarmaq. *Dul arvad yetim saxlar; Naxırçıya minnət qoyar.* (Məsəl). [Cavadov:] *Siz camaatın öz malını özünə qaytarırsınız, hökumətə minnət qoya bilməzsiniz*. Ə.Haqverdiyev. ..[Qulam müəllim] *bilirdi ki, yaxşılıq edib, minnət qoymaqdan da dünyada pis şey yoxdur.* S.Rəhimov. **Minnətə getmək** – bir şey və ya iş üçün birisinin yanına xahişə getmək, xahişlə müraciət etmək. [Həbib bəy:] *Kərbəlayı, içərimizdə yenə hörmətli sənsən. Zəhmət çək, hacının yanına minnətə get*. S.Rəhman. **Minnətə gəlmək** – bir şey və ya iş üçün birisinin yanına xahişə gəlmək, gəlib xahiş etmək. **Minnət(in) olsun!** – özü(n) üçün şərəf hesab et(sin)! *Minnətin olsun ki, sizə gəlmişəm.*

**MİNNƏTÇİ** *is.* Özgə üçün başqasından bir şey xahiş edən, minnət edən. [Sona] *qapısına gələn bir çox elçiləri, minnətçiləri boş yola saldı.* Ə.Əbülhəsən. [Şahpəri Yusifə:] *Gecə-gündüz minnətçi minnətçi dalısınca gəlirdi, bəs necə oldu?* B.Bayramov. ☐ **Minnətçi düşmək** – özgəsi üçün xahiş etmək, minnət etmək, vasitəçi olmaq. *..Başda Molla Qafar olmaqla, Kərbəlayı Hətəmxana neçə gün minnətçi düşüb onu yola gətirməyə çalışırlar.* S.Rəhimov. **Minnətçi getmək** – birisi üçün xahişə getmək, iş düzəltmək üçün birisinin yanına getmək.

**MİNNƏTÇİLİK** *is.* Minnətçi olma, vasitəçilik etmə; vasitəçilik.

**MİNNƏTDAR** *sif.* [*ər.* minnət və *fars.* ...dar] 1. Birindən gördüyü yaxşılığa qarşı mütəşəkkir olan, minnətə qarşı özünü borclu hiss edən, yaxşılıq bilən, razılıq edən. ..[Qadir] *özünü minnətdar göstərmək istəyən vəziyyətdə .. dedi.* Ə.Əbülhəsən. [Fəridə Fərəcə:] *Sağalan körpələr, minnətdar analar.. Vahidovlar familiyasını yaxşılıqla yad eləyər!..* Ə.Məmmədxanlı. // Minnətdarlıq ifadə edən. *O, gözlərini açdı və minnətdar baxışla Öməri başdan-ayağa oxşadı.* Çəmənzəminli. ☐ **Minnətdar etmək** – yaxşılıq qarşısında birini özünə borclu etmək. [Qətibə:] *Gözəl Səba, – dedi, – sən məni bu xidmətinlə minnətdar edirsən.* M.S.Ordubadi. **Minnətdar olmaq** – edilən yaxşılığa, hörmətə qarşı özünü birinin qabağında borclu saymaq. [Leyla:] *Mənim həyatımı təhlükədən qurtardınız. Həmişə sizə minnətdar olacağam.* M.S.Ordubadi. [İsmayılzadə:] *Belə bir saray üçün neftçilərimiz hər zaman sizə minnətdar olacaqlar*. Z.Xəlil.

2. **Minnətdaram (minnətdarıq)** şəklində – çox razıyam (razıyıq), təşəkkür edirəm (edərik), özümü(zü) borclu hiss edirəm (edirik). *Mən sənə ömrüm boyu ürəkdən minnətdaram; Gözə görünməsə də şərəflidir sənətin*. S.Rüstəm. *Dünyanı azacıq dərk etdiyimçün; Yenə gözlərimə minnətdaram mən*. B.Vahabzadə.

**MİNNƏTDARLIQ** 1. *is.* Göstərilən diqqətə, edilən yaxşılığa qarşı razılıq, məmnunluq hissi; təşəkkür. *Yarməmmədin ürəyində Kəngərliyə qarşı minnətdarlıqdan başqa bir duyğu yox idi.* M.İbrahimov. *..Mən sizin etimadınıza qarşı ancaq minnətdarlığımı bildirə bilərəm.* Q.İlkin. ☐ **Minnətdarlıq etmək** – öz təşəkkürünü bildirmək, öz razılığını göstərmək, bildirmək. [Kərim bəy] *orta məktəb bitirəndə ona qızıl saat almış müəllimlərinə ziyafət verib minnətdarlıq etmişdir*. Mir Cəlal.

2. **Minnətdarlıqla** şəklində *zərf* – böyük razılıq hissilə; hörmətlə, ehtiramla. *Rüxsarə*

*xüsusi minnətdarlıqla alimin qarşısında başını əyib ona təzim etdi.* S.Rəhimov. *Aydın minnətdarlıqla* [Gülqönçəyə] *baxdı.* H.Seyidbəyli.

**MİNNƏTLİ** *sif.* Minnət qarşısında, minnətlə edilən, özünə borclu etmək üçün edilən; təmənnalı. *Minnətli plovdansa, minnətsiz pendir-çörək yaxşıdır.* (Ata. sözü).

**MİNNƏTSİZ** *sif.* və *zərf* Minnəti olmayan, minnət qoymayan, əvəzində heç bir şey istəməyən, minnət güdməyən. *Ömrümə rövnəq verən, minnətsiz minnət çəkən, ağrıma dözən Ruqiyyə idi, Ruqiyyə...* A.Divanbəyoğlu. [Qara Musa] *ailəsini bəsləyəcək minnətsiz bir ələ güvənirkən, Tanrı onu da ona çox gördü.* H.Cavid. // Heç bir qarşılıq tələb etməyən, əvəzsiz, təmənnasız. [Əsəd] *geridə qalan ekskavatorçulara minnətsiz kömək edərdi.* S.Vəliyev.

**MİNNƏT-SÜNNƏT** *is.* [*ər.*] *dan.* Ayağa düşüb xahiş etmə; xahiş, yalvarış, rica. ☐ **Minnət-sünnət etmək** – ayağa düşərək xahiş etmək, yalvarmaq. *Kişi nə qədər minnət-sünnət elədi, arvad razı olmadı*. (Nağıl).

**MİNOMYÓT** [*rus.*] bax **minaatan**. *Minomyot atəşi. Minomyot atmaq.*

**MİNOMYOTÇU** *is.* Minomyot atan, minomyotçu hissələrində qulluq edən əsgər. *Aslan onu yaxşı bir minomyotçu kimi təriflədi.* S.Vəliyev.

**MİNONÓS** [*rus.* миноносец] bax **mina gəmisi** (“**mina**”da). *Minonosda xidmət etmək.*

**MİNÓR** [*ital.* minere] *mus.* Səsləri, kiçik tersiya əsasında qurulmuş akkord əmələ gətirən musiqi ladı (hüzn, kədər əhval-ruhiyyəsi ilə bağlı olan səs boyaları ilə səciyyələnir) (*major* əksi). *Avropa musiqisi əsas etibarilə iki kök: major və minor əsasında qurulmuşdur.* Ə.Bədəlbəyli.

**MİNOTAVR** *is.* Qədim yunan mifologiyasında Minosun arvadı Pasifayanın Poseydonun müqəddəs öküzündən doğduğu nəhəng yarıadam, yarıat; bəzi variantlarda öküz başlı, insan bədənli varlıq.

**MİNTƏNƏ** [*fars.* nimtənədən] bax **nimtənə**. [Hacı Saleh:] *Amma, ağa, mintənənin ölçüsü məlum olsa, çox yaxşı olardı.* M.F.Axundzadə.

**MİNVAL** *is.* [*ər.*] Qayda, tərz, yol, üsul. ☐ **Bu minvalla, bu minval ilə** – bu qayda ilə, bu cür, həmin tərzdə. *..Bunları tanımağım və dost olmağım bu minvalla əmələ gəldi.* C.Məmmədquluzadə. *Bir neçə ay Aslan bu minvalla dolandı.* C.Cabbarlı. [Həmzə bəy] *neçə illər idi ki, ömrünü bu minval ilə keçirirdi.* Çəmənzəminli.

**MİOKÁRD** [*yun.* muo – əzələ və kardia – ürək] Ürəyin əzələ divarcığı.

**MİOKARDÍT** [*yun.* muo – əzələ və kardia – ürəkdən] *tib*. Ürək əzələsinin iltihabı.

**MİR** *is.* [*fars.* əsli *ər.* “əmir”dən] 1. *klas.* Rəis, başçı, ağa. *Hökmünə məhkum olmuşuz sultanımızdır mirimiz.* Nəsimi.

2. *din.* Bəzi adam adlarının əvvəlinə artırılaraq onların seyid nəslindən olduğunu göstərir; seyid; məs.: Mirəli, Mirhəsən.

**MİRAB** *is.* [*ər.* mir və *fars.* ab] *tar.* Keçmişdə Şərq ölkələrində suvarma işlərinə nəzarət edən şəxs. [İskəndərzadə:] *Mən mirabı çağırtdırmışam.* Ə.Haqverdiyev. [Allahverdi:] *Kətxudaya ver, yüzbaşıya ver, köməkçiyə ver, miraba ver..* C.Cabbarlı.

**MİRABEL** *is.* [*fr.*] Sarı gavalı növü.

**MİRABLIQ** *is. köhn.* Mirabın vəzifəsi, işi. *Əhməd də kənddə mirablıq vəzifəsini ona tapşırmağı vəd etdi*. B.Talıblı.

**MİRAXUR** *is.* [*fars.*] *tar.* Qədim zamanlarda padşahın, xanın baş mehtəri; mehtərbaşı. *Şurişin əvvəlimci səbəbi məzul miraxur idi ki, küçədə köhnə xəzinədara rast gəlib, ona yoldaş olub soruşdu.* M.F.Axundzadə. *Miraxur gəlib xəbər verdi ki, xanın çox istədiyi kürən atı bir sancı tutub, hər nə edirlərsə, kargir olmur.* Ə.Haqverdiyev.

**MİRALAY** *is. köhn.* Polkovnik. *Jandarm onbaşısı mətbəəyə girdi, vəziyyəti jandarm miralayına xəbər verib yenə də bayıra çıxdı.* M.S.Ordubadi.

**MİRAS** *is.* [*ər.*] 1. Ölən adamdan sonra varislərə qalan mal, mülk və s. *Miras bölgüsü. Miras çatmaq. – Ağca xanım evində həmişə ata mirası deyib əzizlədiyi piləkli məxmərə altdan-yuxarı qəzəblə baxdı.* Mir Cəlal. *Lakin hələ ili tamam olmamış kişinin mirasına əl vurmaq yaramazdı.* B.Bayramov.

2. Keçmiş dövrlərdən qalmış adət, ənənə və s. *Atalar səpən oğullara mirasdır.* (Ata.

sözü). *Sındırmaq asandır, yaratmaq çətin; Sənət mirasıdır əbədiyyətin.* M.Rahim. □ **Miras qalmaq** – qabaqkı dövrlərdən irsən keçmək, çatmaq (hər hansı bir şey), yadigar qalmaq. *Həlimə ölkəyə miras qalmış ətrafdakı bu xarabalıqlar və ona gülümsəyən gözəl gələcək haqqında düşünürdü.* Ə.Məmmədxanlı. *Övladlara miras qalmış anaların çox adəti.* M.Dilbazi. **Mirasa qalmış!** – qarğış, nifrin məqamında işlənir. *Nisabəyim xanım içəri girib: – Götür mirasa qalmış təsbehi! – deyə Rəhim ağanın başına çalır.* M.S.Ordubadi.

**MİRÇALIQ** *is. bot.* Yeməli, yabanı bitki.

**MİRQƏZƏB** *is.* [*fars.* mir və *ər.* qəzəb] Cəllad. *Məmurbaşı mirqəzəb kimi bir də adamları gözdən keçirdi..* S.Rəhimov. [Qüdrət:] [Mollayev] *bir gün mehriban görünür, adamı tərifləyib göyə qaldırır, o biri gün mirqəzəb kimi başını korş balta ilə kəsir.* M.Hüseyn.

**MİRVARİ(D)** *is.* [*fars.*] b a x **inci** 1-ci mənada. *Mirvari dənəsi. Üç sap mirvari. Mirvari boyunbağı. – Sıçrayarkən işıldayar damcılar; San saçılar mirvaridlər, incilər.* A.Səhhət.

**MİRVARİLİ** *sif.* Mirvarisi olan, mirvari ilə bəzənmiş. *Mirvarili sırğa.*

**MİRZƏ** *is.* [*fars.* "əmirzadə"nin ixtisarı] 1. *tar.* Şəxs adlarından sonra gəldikdə şahzadəlik, əvvəl gəldikdə isə rütbə bildirir; məs.: Sam mirzə, Abbas mirzə, Əbubəkr mirzə.

2. *köhn.* Savadlı adam. *Mirzələr qəzet yazıb; Aşıqlar dastan eləyib.* Aşıq Ələsgər. // Bu kimi adamlara ehtiramla müraciət məqamında işlədilir. [Mir Hadi:] *Mirzə, yəqin ki, cənablarınızın elmi-təvarixdən xəbəri var.* Qantəmir. [Hüseyn:] *Xeyr, mirzə, tanımıram, mən heç bu cür adam görməmişəm.* S.Rəhman. // Savadlı, elmli, bilikli, hörmətli şəxslərin adlarına əlavə edilir. *Mirzə Fətəli Axundzadə. –* [Səhhət:] *Mirzə Cəlil damcıdan; Axı ümman yaratdı.* B.Vahabzadə.

3. Keçmişdə yazı-pozu işləri ilə məşğul olan adam; katib. [Nisə xanım:] *Sən köhnə vəzirin oğlu Mirzə Səlimi gətirib özünə mirzə eləmisən.* M.F.Axundzadə. [Toğrul:] *Dərhal mirzəsini çağırıb, Qızıl Arslana məktub göndərdi.* M.S.Ordubadi.

**MİRZƏLİK** *is.* Yazı-pozu işi ilə məşğul olma; mirzə vəzifəsi; katiblik. *Qəhrəmanı heç bir dəftərxanada mirzəliyə götürmürdülər.* S.Rəhimov.

**MİRZƏYİ** *is. mus.* Ağır-ağır oynanılan Azərbaycan xalq rəqsi və bu rəqsin havası. *Mirzəyi çalmaq. – Məşədi İbad mirzəyi havasını oynayır.* Ü.Hacıbəyov. *Mirzəyi havasında bu vəzn ağır və aramla vurulur.* Ə.Bədəlbəyli.

**MİS** *is.* 1. Özlü və döyülə bilən qırmızımtıl metal – kimyəvi element. *Mis mədəni. Mis külçəsi.*

2. Bu metaldan düzəldilmiş. *Mis kasa. Mis məcməyi. Mis nimçə. Mis pul. – Dədə-babadan qalma bir neçə parça mis qab var idi ki, Reyhan xanım onları birər-birər satmağa başladı.* T.Ş.Simurq. *Laçın cəld getdi, bir mis ləyən və bir də qara aftafa gətirdi.* H.Nəzərli.

3. *məc.* Qırmızı-sarı, mis rəngində. *Qaçay ilə Göyçək ani olaraq bir-birinə baxdılar. İkisi də başını aşağı salıb qıpqırmızı misə döndülər.* Ə.Vəliyev.

**MİSAL** *is.* [*ər.*] 1. Həll edilməsi üçün rəqəmlər üzərində bəzi əməliyyat tələb edən riyazi ifadə. *Misalları həll etmək. Misalın cavabını yoxlamaq.*

2. Bir fikrin anlaşılmasını asanlaşdırmaq və ya bir şeyi sübut etmək üçün gətirilən dəlil, nümunə və s. *Fikrini misallarla aydınlaşdırmaq. –* [Məşədi Haşım] *ərəb və İran ədəbiyyatından misallar gətirdi.* S.Rəhman.

3. Nümunə, örnək, timsal. *Yoldaşını misal göstərmək. – Sən bizim öz həyatımızı misal götürə bilərsən.* M.S.Ordubadi.

4. Bir şeyin bənzəri, oxşarı, tayı, bərabəri, misli. *Nə xoş olur eşq əhlinin bu halı; Şəmə yana pərvanənin misalı.* M.V.Vidadi. [Vəzir:] *Hacı Saleh, gərəkdir Rəştdə bir mintənə tikdirəsən, yeri zərbaftdan ki, misal və bərabəri bu vaxtadək Lənkəranda görünməmiş ola.* M.F.Axundzadə. *Dünyada igidlikdə mənim yoxdu misalım.* Ə.Nəzmi.

5. Zərbi-məsəl. *Canandan ayrılan candan ayrılır; Xalq içində bir misaldı, sevdiyim!* M.P.Vaqif. *Gülyanaq dinləyir, Xanpəri misal çəkir, dəlil-sübut gətirir.* Ə.Vəliyev.

**MİSALLI** *sif.* Adətən sözün əvvəlində gəlib, "oxşayan", "bənzəyən", "bənzər", "kimi" mənası verir. *Şirmayı həmişə atasını çəkic altında döyülməkdən bərkiyən polad misallı insanlara bənzədirdi.* M.Hüseyn.

**MİSƏRİDƏN** *sif.* Mis əritmək üçün olan. *Misəridən soba.*

**MİSGƏR** *is.* [*fars.*] Misdən müxtəlif qablar qayıran usta. *Əlli qədəm bir-birindən aralı böyük misgər kürəsi və bu kürəyə münasib bir körük nəsb olub.* M.F.Axundzadə. *..Misgərlər, dəmirçilər arasında iş aparmaq üçün də adam təyin etmək lazımdır.* P.Makulu.

**MİSGƏRLİK** *is.* Misgər sənəti, işi, peşəsi. *Misgərlik eləmək.*

**MİSİLSİZ** *sif.* Misli, tayı-bərabəri olmayan, müqabili, əvəzi olmayan; nadir. *Misilsiz gözəl. – Həyatimdə səfalı bir bağ salacağam mən; Yurdumda bir misilsiz bağban olacağam mən.* M.Müşfiq. *Xanlar xanı Bayındır xan misilsiz bir bayram şənliyi qurmuşdu.* M.Rzaquluzadə.

**MİSİRLİLƏR** *cəm, tar.* Misrin əsas əhalisini təşkil edən xalq.

**MİSİRŞÜNAS** *is.* [*ər.* misir və *fars.* ...şünas] Misirşünaslıq mütəxəssisi.

**MİSİRŞÜNASLIQ** *is.* Qədim Misrin tarixini, dilini, iqtisadiyyatını, incəsənətini və s. öyrənən elmlərin məcmusu.

**MİSKİN** *sif.* [*ər.*] 1. Fağır, biçarə, bədbəxt, yazıq. *Leyli! – dedi, verdi cani-şirin; Ol aşiqi-biqərarü miskin.* Füzuli. [Dərviş:] *Şikarını itirmiş səyyad kimi boynuburuq məlul və miskin* (z.) *ocaq qırağında qaldım*. A.Divanbəyoğlu.

2. Bacarıqsız, aciz, əlindən heç bir iş gəlməyən, düşkün. *Miskin adam.* – [Rəhim bəy] *yalnız jandarm yanında deyil, öz doğma oğlunun da .. yanında xırda, miskin bir xəbərçi kimi biabır olmuşdu.* M.Hüseyn.

**miskin-miskin** *zərf* Fağır-fağır, yazıq-yazıq, aciz halda. *Miskin-miskin gəzmək. Miskin-miskin baxmaq.*

**MİSKİNLƏŞMƏ** "Miskinləşmək"dən *f.is.*

**MİSKİNLƏŞMƏK** *f.* Miskin hala düşmək; fağırlaşmaq, acizləşmək, əlindən heç bir şey gəlməmək. *Məğrur sərkərdə özünün miskinləşmiş ordusu ilə bərabər müqəddəs rus torpağından qovuldu.* M.Hüseyn.

**MİSKİNLİK** *is.* Fağırlıq, bədbəxtlik, biçarəlik, yazıqlıq, acizlik, düşkünlük. *Yetər, miskinlik yetər; Qalx! Oyan, oyan, oyan!..* H.Cavid. [Kor] *məzlumluğu sevən, miskinlikdən ruhani bir zövq alan bir adam idi.* S.Hüseyn.

**MİSQAL** *is.* [*ər.*] Təxminən 4,26 qrama bərabər köhnə çəki vahidi. [Hacı Kərim:] *Bir misqal ondan bir batman misə vurub xalis gümüş olur*. M.F.Axundzadə. *Onlar kağız arasındakı beş-altı misqal barıtı çuxura tökdülər*. P.Makulu.

**MİSQALI[1]: misqalı tirmə** – keçmişdə qiymətli, zərif tirmə növü. *Bəyin anası əyninə misqalı tirmədən don geyərdi.* H.Sarabski.

**MİSQALI[2]** *is. bot.* Qalınqabıqlı üzüm növü.

**MİSQALLIQ** *sif.* Saylarla işlənərək, bir şeyin neçə misqal ağırlıqda olduğunu göstərir. *4 misqallıq üzük.*

**MİSQAL-TƏRƏZİ** *is.* [*ər.* misqal və *fars.* tərazu] Qızıl, qaş-daş və başqa qiymətli şeyləri çəkmək üçün kiçik dəqiq tərəzi. [Dərviş:] *Bu var ki, əfəndim, Bakıda olan cəmi zərgərlər misqal-tərəzini düzəldib noxud əhvalatına*. N.Vəzirov. ☐ **Misqal-tərəzi ilə ölçmək (çəkmək)** – bir şeyin ölçü və vəznini çox diqqətlə, dəqiq təyin etmək.

**MİSL** *is.* [*ər.*] 1. Bənzər, oxşar, tay. *Bunun misli ola bilməz. – Hüsn içində görməmiş mislin fələk; Bunca dövranı ki, dövran eyləmiş.* Nəsimi. [Hacı Murad:] *Deyir ki, gərək elə toy eləyəm ki, misli bu şəhərimizdə olmamış ola.* S.S.Axundov. ☐ **Misli-bərabəri olmamaq (tapılmamaq, yoxdur)** – tayı-bərabəri, oxşarı, bənzəri olmamaq (tapılmamaq, yoxdur). *Hər kim Qoşabulağın o köpüyündə çimsə, elə qüvvətli bir igid olar ki, dünyada misli-bərabəri tapılmaz*. "Koroğlu". [Bürcəliyev:] *Ağbulaq turş suyunun bəlkə heç bütün dünyada əsla misli-bərabəri yoxdur.* S.Rəhimov.

2. Dəfə, kərə. *İki ilə üçün misli altıya bərabərdir.*

**MİSLƏMƏ** "Misləmək"dən *f.is.*

**MİSLƏMƏK** *f.* Metal şeylərin üzünü mislə örtmək; mis çəkmək. *Borunun üzünü misləmək.*

**MİSMAR** *is.* [*ər.*] Mıx. *..Mən elə pis uşaq görmüşəm ki, əlinə mismarı, ya bıçağı alıb divarları cızıb xarab eləyir.* C.Məmmədqulu-

zadə. *Qulam müəllim* .. [çantanı] *yuxarıdan divara vurulmuş mismardan asdı.* S.Rəhimov.

**MİSMARLAMA** "Mismarlamaq"dan *f.is.*

**MİSMARLAMAQ** *f.* Mismar vurmaq, mismar vurub bərkitmək; mıxlamaq. [Camal] *yeşiyin qapağını qoyub bərk-bərk mismarladı.* Ə.Vəliyev.

**MİSMARLANMA** "Mismarlanmaq"dan *f.is.*

**MİSMARLANMAQ** *məch.* 1. Mismar vurulmaq; mismarla vurulub bərkidilmək; mıxlanmaq.

2. *məc.* Bağlanmaq. *O gündən etibarən hamamın qapısı mismarlandı, önünə zibil tökülməyə başlandı.* Çəmənzəminli.

**MİSRA** *is.* [*ər.*] Şerin ayrılıqda götürülmüş bir sətri. *Qəzəldən iki misra demək. Şerin misrası. – Xanqızı .. Vaqifin hər misrasından doğan atəşi göz yaşları ilə söndürməyə çalışırdı.* Çəmənzəminli. *Aldığım mövzuya candan sarılıb; Misradan misraya atıldığım yox.* M.Müşfiq.

**MİSRALIQ** *is.* Adətən saylardan sonra gələrək şerin neçə misradan ibarət olduğunu bildirir. *20 misralıq şeir. – Mən dörd misralıq şerimdə, uzun zamanlar mələkəni düşünərək, keçirdiyim acı iztirabların ifadəsini verə bilməmişəm.* M.S.Ordubadi.

**MİSRİ**[1] *sif.* Misirə məxsus. Misirə mənsub. // Misirli.

◊ **Misri qılınc** – Koroğlunun qılıncına verilən ad. *Misri qılınc hamayıldı belində; Geyər hər vaxt al-qumaşı Koroğlu.* "Koroğlu".

**MİSRİ**[2] *sif.* [*ər.*] *köhn.* Yoluxucu, keçici, sirayətedici. *Misri xəstəliklər. – Yazırsan bu naxoşluq misri naxoşluq kimi bir şeydir və ilaax..* C.Məmmədquluzadə.

**MİSS** [*ing.* miss] İngiltərə və Amerikada ərə getməmiş qadın (adətən ad və ya familiyanın əvvəlində işlədilir). *Miss Hannanın bütün ümidləri kəsilirsə də, təslim olmamağı qərara alır.* M.S.Ordubadi.

**MİSSİONÉR** [*fr.* missionnaire, əsli *lat.*] Xristian olmayan əhali arasında xristianlığı yaymaq üçün xristian kilsəsi tərəfindən göndərilən şəxs. *Şeyxin Afrikada .. ingilis missioneri olduğu meydana çıxdı.* M.S.Ordubadi.

**MİSSİONERLİK** *is.* Missionerin gördüyü iş, fəaliyyəti.

**MİSSİYA** *is.* [*lat.*] Vəzifə, borc.

**MİSTER** *is.* [*ing.*] Kişilərə müraciət məqamında işlənən söz; cənab.

**MİSTİK** *sif.* 1. Mistikaya, mistisizmə aid olan, mistikadan ibarət olan, mistika mahiyyəti daşıyan. *Mistik etiqadlar.*

2. *məc.* Sirli, müəmmalı, anlaşılmaz, fövqəltəbii.

**MİSTİKA** [*yun.* mystika] 1. Fövqəltəbii, ilahi, gizli bir qüvvəyə inanış; insanın bilavasitə "fövqəltəbii qüvvələrlə" əlaqəyə girə bilməsinə inanan batil, elmə zidd etiqad. *Orta əsr mistikası.*

2. *məc.* Sirli, müəmmalı, anlaşılmaz, qətiyyən izahedilməz şey haqqında.

**MİSTİSİZM** [*lat.*] Mistikaya əsaslanan dini-idealist dünyagörüşü; mistikaya meyil.

**MİSYAYAN** *sif. tex.* Mis tökmələrini yastılayıb təbəqə şəklinə salan. *Misyayan maşın.*

**MİŞAR** *is.* Ağac, taxta, habelə dəmir, daş kəsmək üçün zolaq və ya dairə şəklində polad təbəqəsindən düzəldilmiş diş-diş alət; bıçqı. *Taxtanı mişarla kəsmək. İti mişar.*

**MİŞARAĞZI** *is.* Mişarla ağacı kəsdikdə tökülən xırda ovuntu; taxtakəpəyi, mişarkəpəyi. *Sürüşkən yerə mişarağzı səpirlər.*

**MİŞARAOXŞAR** *sif.* Dişli, diş-diş. *Mişaraoxşar dəmir parçası.*

**MİŞARBALIĞI** *is. zool.* Üstündə mişar dişinə oxşayan çıxıntıları olan uzunburun, yırtıcı iri dəniz balığı.

**MİŞARÇI** *is.* Mişarla ağac kəsən, mişarla taxta kəsən adam. *Mişarçılar taxta kəsirlər. – ..Cəfərin əmisi Məşədi İbrahim mişarçı idi.* M.Arif.

**MİŞARÇILIQ** *is.* Mişarçı sənəti, peşəsi, işi. *Mişarçılıq etmək.*

**MİŞARDAŞI** *is.* Mexaniki mişarla eyni ölçüdə kəsilmiş daş; kubik daşı.

**MİŞARDİŞLİ** *sif.* Mişar kimi dişləri olan. *Gavalımeyvəlilər .. ağaclar cinsi və bəzi kollardır. Yarpaqları ellipsşəkilli olub ucu sivridir, kənarları mişardişlidir.* M.Qasımov.

**MİŞARXANA** *is.* Şalbandan taxta kəsilən emalatxana; dülgərxana.

**MİŞARKƏPƏLİ** b a x **mişarağzı**.

**MİŞARLAMA** "Mişarlamaq"dan *f.is.*

**MİŞARLAMAQ** *f.* Mişarla kəsmək. *Kiçik Fərman saatlarla atasının yanında durub ona tamaşa edər, mişarlayıb atdığı taxta parçaları və talaşalarla oynardı.* Ə.Sadıq.

**MİŞARLANMA** “Mişarlanmaq”dan *f.is.*

**MİŞARLANMAQ** *məch.* Mişarla kəsilmək.

**MİŞARLATMA** “Mişarlatmaq”dan *f.is.*

**MİŞARLATMAQ** *icb.* Mişarla kəsdirmək. *Taxtanı mişarlatmaq.*

**MİŞARLI** *sif.* Mişarı olan. *Mişarlı daşkəsən maşın.*

**MİŞARVARİ** *sif.* Mişarabənzər, mişar kimi; mişaraoxşar, diş-diş.

**MİTİL** *is.* 1. Yorğanın, döşəyin, balışın alt üzü. *Balışa mitil almaq. Mitili təzələmək. Mitili yumaq. – Yorğanın mitili dağılmış, balışüzünün tükləri üzə çıxmışdı.* S.Vəliyev.

2. Üzü olmayan, üz çəkilməmiş yorğan, döşək, balış və s. *Evin bütün şeylərini elə aparıblar ki, bir quru tikili qalıb, bir də Əzizin özü yatdığı mitil.* (Nağıl). [Sərvinaz Şahmara:] *Ata-babamız öz üstünə çəkməyə mitil tapmayanda, xaradan qonaq yorğanı düzəltdirib.* B.Bayramov. // Sif. mənasında. *..O, üst paltarını çıxarıb bir mitil cındır yorğana büründü.* S.S.Axundov.

3. *sif.* Köhnə, dağılmış, yıpranmış, cındır. *Mitil palto. Mitil xalça. Mitil döşəkcə.*

4. *məc. zar.* Tənbəl, aciz, bivec, işə-gücə yaramayan adam haqqında. *Mitilin biridir.*

◊ **Mitili çıxmaq** *zar.* – 1) tamam köhnəlmək, tökülmək, yıpranmaq, cındırı çıxmaq. *Şkafın mitili çıxıb.* – [Səriyyə xala] *mitili çıxmağa başlayan yorğanı uşaqların çiyninə saldı.* M.İbrahimov; 2) *məc. zar.* yorulub əldən düşmək, daha işləməyə halı olmamaq. *O qədər işləyib ki, mitili çıxıb.* **Mitilini bayıra atmaq** *zar.* – kobudcasına qovmaq, çıxarmaq, işdən qovmaq.

**MİTİLLƏŞMƏ** “Mitilləşmək”dən *f.is.*

**MİTİLLƏŞMƏK** *f. dan. zar.* bax **mitili çıxmaq** (“**mitil**”də). *Mitilləşib, daha işləyə bilmir.*

**MİTİLLİK** 1. *sif.* Mitilə yarar, mitil üçün olan. *Mitillik bez. Mitillik çit.*

2. *is.* Mitilliyə yarar parça. *Mağazadan mitillik almaq.*

3. *sif. dan. zar.* Ruhən və cismən düşkünlük.

**MİTİL-ŞİTİL** *top. dan.* Üzü tökülmüş, dağılmış, yıpranmış, köhnə, cındır yorğan-döşək, palaz və s. *Əsgər addımlayıb Kosanın mitil-şitilini tərpətdi, ağac çarpayısını yırğaladı.* S.Rəhimov. *Arada bir dönüb evin içinə döşənən mitil-şitilə bax*(*dı*). Ə.Əbülhəsən.

**MİTİNQ** [*ing.*] Hər hansı mühüm gündəlik məsələyə (ən çox siyasi məsələyə) həsr olunmuş kütləvi yığıncaq. *Mitinqi açıq elan etmək. Matəm mitinqi.* – [Səfərəli:] *Bugünkü mitinqin siyasi əhəmiyyəti vardır.* H.Nəzərli. *Yığıncaqlarda, mitinqlərdə hər yerdən şüarlar eşidilirdi.* Ə.Sadıq. □ **Mitinq qurmaq** – kütləvi yığıncaq düzəltmək, iclas qurmaq, nitqlər söyləmək. [Rüstəm kişi:] *Nədir, burda mitinq qurmusunuz?* M.İbrahimov.

**MİTQAL** *is.* [*ər.*] Sərt nazik pambıq parça. // Bu parçadan tikilmiş. *Mitqal köynək.*

**MİTOZ** *is.* [*yun.*] Hüceyrələrin ən geniş yayılmış bölünmə üsulu.

**MİTRA** *is.* [*rus.*] Dini ayin zamanı keşişlərin başlarına keçirdikləri qızılı rəngli papaq.

**MİTRALYÓZ** [*fr.*] *köhn.* Pulemyot. *Atlar kişnəyir, mitralyozlar qəhqəhə çalırlar.* H.Nəzərli.

**MİTROPOLİ́T** [*yun.* metropolites] Pravoslav və katolik yepiskoplarının ən yüksək adı, habelə bu adı daşıyan ruhani.

**MİYAN** *is.* [*fars.*] *klas.* 1. Bel, kəmər. *Miyanında saçın ucun hörməyi; Bütün dünyada bu yarı tutmuşam.* M.P.Vaqif.

2. Orta, aralıq, ara.

**MİYANÇA** *is.* Tuman paçalarının arasına salınan parça.

**MİYANÇI** *is.* İki tərəf arasında vasitəçi, araçı. *Miyançının kisəsi gen olar.* (Ata. sözü). *..Miyançılar işə qarışır, yaxşı-yaxşı tərifləyir, .. sövdəni sarıyırdılar.* S.Rəhimov.

**MİYANÇILIQ** *is.* Miyançının işi; araçılıq, vasitəçilik. [Şirin] *qocalandan sonra başladı əvvəl miyançılığa.* N.Vəzirov. [Kərbəlayı Xəlil] *əvvəllər at alıb-satanlar arasında miyançılıq eləməklə az-çox qazanmış, axırda bu işdə bir mütəxəssis kimi tanınmışdı.* P.Makulu.

**MİYANDAR** *is.* [*fars.*] *köhn.* Məclisi idarə edən şəxs, yaxud zorxana təlimçisi, zorxananı idarə edən adam. *Məclisin miyandarı. – Qırx il işləyib, indi miyandar olmuşam.* (Ata. sözü). *Miyandarın işarəsilə Məmməd bəylə Qasım ağa dairənin ortasına güləşə çıxdılar.* Çəmənzəminli.

**MİYANDARLIQ** *is.* Miyandarın işi.

**MİYANƏ** *sif.* [*fars.*] Nə yaxşı, nə də pis; orta, babat. *Miyanə geyim. Miyanə yemək.* – *..Nə elə də artıq ləzzətli və nə elə də artıq ləzzətsiz, yəni miyanə.* C.Məmmədquluzadə. *Yaxşılar yol çəkən, pislər yol sökən; Miyanə adamlar yuxuma girmir.* M.Araz. // Orta. *Yarlı-yaraşıqlı boyu, gərdəni; Nə uzun, nə gödək, miyanə gərək.* Q.Zakir.

**MİYANPUR** *is.* [*fars.*] İçinə qoz ləpəsi doldurulmuş şaftalı, ərik və s. qaxı. *Süfrədə tut qurusu, miyanpur, innab, ləbləbi, kişmiş, səbzə, alma, portağal da olardı.* H.Sarabski.

**MİYANTƏNG** *is.* [*fars.*] Ətin budla qabırğa arasında olan hissəsi.

**MİYOPİŞİYİ** *is. zool.* Çölpişiyi, yazıpişiyi.

**MİYO(V)LAMA** "Miyo(v)lamaq"dan *f.is.*

**MİYO(V)LAMAQ, MİYOLDAMAQ** b a x **miyovuldamaq**. *Dünən yem verilməmiş pişik miyoldaya-miyoldaya* (z.) *kişinin qabağına yüyürdü*. Çəmənzəminli. *Nərgizin mehriban səsini eşidən Topuş dayandı, dönüb geri baxdı, şikayətli bir səslə miyoldadı.* Ə.Məmmədxanlı.

**MİYOV-MİYOV** *təql.* Pişiklərin çıxardığı səs; miyovultu.

**MİYOVULDAMA** "Miyovuldamaq"dan *f.is.*

**MİYOVULDAMAQ** *f.* Miyovultu səsi çıxarmaq (pişik haqqında). *Pişik miyovuldayır.*

**MİYO(V)LDAŞMA** "Miyo(v)ldaşmaq"dan *f.is.*

**MİYO(V)LDAŞMAQ** *qarş.* Bir yerdə miyovultu səsi çıxarmaq (bir neçə pişik). *Kök pişiklər harın-harın miyoldaşır, zəncirə vurulmuş qıllı köpəklərin gözlərindən qan damırdı.* B.Bayramov.

**MİYOVULTU** *is.* Pişiyin çıxardığı səs.

**MİZ¹** *is.* [*fars.*] Stol, masa. *Sədr məclisi sakit etmək üçün qalxıb qarşısındakı mizi döydü.* T.Ş.Simurq. *Üstü qırmızı örtüklü mizin ətrafında yeddi nəfər oturdu*. H.Nəzərli.

**MİZ²** *sif.* Şiş, iti, biz. *Miz saqqal*. – [Şeyx İsa] *uzaqdan baxanda 80 yaşında, uzunsaqqal və saqqalının ucu da miz bir insandır.* C.Məmmədquluzadə.

**MİZAC** [*ər.*] b a x **məzac**. *İncitdimi dərdi-dil mizacın; Kim, oldu təbibə ehtiyacın?* Füzuli. [Hacı:] *Şərab həmişə insanın mizacını açır, kefini yüksəldir.* B.Talıblı.

**MİZAN** *is.* [*ər.*] 1. Çəki aləti, tərəzi. *Əl mizan, göz tərəzi*. (Ata. sözü). *Hər nə çəksən, çək, bəradər, çəkmə düz mizanını; Çəkmə sən millət qəmin, çəkmə, çək öz qəlyanını*. M.Ə.Sabir.

2. Qayda, nizam, səliqə, sahman. [Otaqları] *nəfis xalçalarla döşəmiş və evin hər bir şeyinə o mizanda diqqət vermişdi.* M.S.Ordubadi. ☐ **Mizana düşmək** – qayda və səliqəyə düşmək, nizamlı və səliqəli olmaq. *Ev mizana düşdü.* // Qayda-qanun, nizam. *Qərinələr keçdi, dövran dəyişdi; Pozuldu qurğular, mizan qalmadı.* Aşıq Ələsgər.

3. *xüs.* Artistlərin və səhnə şəraitinin, tamaşanın gedişinin ayrı-ayrı momentlərinə görə düzülüşü qaydası. *Rejissor bu gün göstərdiyi mizanı sabah dəyişir və hər gün bir yeni mizan verirdi.* S.Rəhman.

4. Çəki, ağırlıq, vəzn, ölçü.

5. B a x **mizan-tərəzi**. ☐ **Mizana vurmaq** – 1) çəkmək, tərəzidə çəkib ağırlığı bilmək; 2) *məc.* ölçüb-biçmək, mülahizə etmək.

**MİZANQUL** *is. zool.* Bahar fəslində çıxan zərərli həşərat.

**MİZAN-TƏRƏZİ** *is.* [*ər.* mizan və *fars.* tərazu] Dindar müsəlmanların etiqadınca qiyamət günü adamların günah və savabını ölçmək üçün mənəvi tərəzi. ☐ **Mizan-tərəzi qurulmaq** *din.* – məhşər günü günah və savabın haqq-hesabı çəkilmək. [Seyrəksaç dəllək:] *Çünki bu dünyanın axı, Ələmdar qardaş, o dünyası, qiyaməti də var. Bax orada mizan-tərəzi qurulacaq, günah-savab tərəziyə qoyulub misqalına qədər çəkiləcəkdir*. S.Rəhimov.

**MİZLƏMƏ** "Mizləmək"dən *f.is.*

**MİZLƏMƏK** *f.* 1. Miz vurmaq, dürtmə vurmaq, dürtmələmək. *..Bir adam da dal tərəfdən məni hey mizləyir ki, tez ol, get qabağa!* M.S.Ordubadi.

2. Mayenin içərisinə soxmaq, yaş etmək, batırmaq. *Qabaqca qələmin tez-tez davata mizləyib kağızı bir az yanqılıcı tutur.* C.Məmmədquluzadə.

**MİZRAB** *is.* [*ər.*] Bəzi simli musiqi alətlərinin simlərini ehtizaza gətirmək üçün sümükdən, mal buynuzundan və ya plastik maddədən qayrılan nazik plastinka. *Mizrab vurmaq* (*mizrabı simlərə toxunduraraq çalmaq*). – *Tarçının mizrabı pərdələr üzərində hərəkətsiz qaldı.* Ə.Məmmədxanlı.

**MİZRAQ** *is.* [*ər.*] Sivriuclu dəmirdən, poladdan düzəldilmiş uzun saplı qədim döyüş aləti; nizə. *Oynadaq hey süngü, mizraq, çiçəklənsin ana Vətən.* A.Şaiq. *Fəqət bu qəhrəmanlığa, bu çevikliyə qarşı qüvvətli bir mizraq onun intiqamla dolu olan qəlbinə saplandı.* H.Nəzərli.

**MOBƏD** *is.* [*ər.*] Zərdüşt dini kahini.

**MOBİL** *is.* [*fr.*] Mütəhərrik, sürətlə hərəkət edən. *Mobil hərbi hissə.*

**MOBUD** b a x **mobəd**.

**MOD(A)** [*fr.*] Müəyyən dövrdə, müəyyən ictimai mühitdə geyim, tualet, məişət şeyləri və s. cəhətdən bu və ya digər zövq və adətlərin hakim olması. *Bu paltar indi modda deyil. Moda ilə saç qoymaq.* – [Mirzə Salman:] *Nə xəbər? Yəqin yenə deyəcəksən ki, hansı yoldaşınsa özünə təzə modda paltar tikdirib.* S.Rəhman. [Lətafət] *qırx yaşında ucaboylu, moda ilə geyinən gözəl bir qadındır.* İ.Əfəndiyev. // Dəbdə, modda olan şey haqqında. // Cəmdə: **modalar** – belə zövqlərə cavab verən geyim nümunələri. *Qadın modaları. Modalar jurnalı.* □ **Modada (modda) olmaq** – hamı tərəfindən qəbul olunmaq, hamının hüsn-rəğbətini qazanmaq, hamının diqqətini cəlb etmək; yayılmaq, işlənmək, dəbdə olmaq. *O zamanlar Bakıda və Bakının ətraf kəndlərində tapançabazlıq, qoçubazlıq mod olmuşdu.* H.Sarabski. **Modadan (moddan) düşmək (çıxmaq), modası keçmək** – daha işlənməmək, unudulmaq, dəbdə olmamaq, əhəmiyyətini itirmək. **Modaya (moda) düşmək** – b a x **modada (modda) olmaq**.

**MODABAZ** *sif.* və *is.* [*fr.* mode və *fars.* ...baz] Həddindən çox modaya uyan, moda düşkünü, modapərəst, modaçı. *Modabaz qız.*

**MODABAZLIQ** *is.* Modaya uyma, moda düşkünlüyü, modapərəstlik, modaçılıq. *Modabazlıq etmək.*

**MODAÇI** b a x **modabaz**.

**MODAÇILIQ** b a x **modabazlıq**.

**MODÁL** [*lat.*] *dilç.* Modallıq ifadə edən, modallıq bildirən. *Modal sözlər*.

**MODALI** *sif.* Hər hansı bir modaya uyğun olan, modada olan. *Modalı kostyum.* – *Teymur müəllim balaca arıq bir kişi idi. Əyninə köhnə modalı məxmər jilet geyər, başına araqçın qoyardı.* Ə.Sadıq.

**MODALLIQ** *is. dilç.* Nitqin məzmununun gerçəkliyə münasibətini bildirən və feil formaları, intonasiya, ara sözlər və s. vasitəsilə ifadə olunan qrammatik kateqoriya.

**MODAPƏRƏST** [*fr.* mode və *fars.* ...pərəst] b a x **modabaz**. *Modapərəst qadın.*

**MODAPƏRƏSTLİK** b a x **modabazlıq**. *Modapərəstlik etmək.*

**MODÉL** [*fr.*] 1. Bir şeyin nümunə nüsxəsi, habelə bir şeyi hazırlamaq üçün nümunə. *Geyim modelləri sərgisi.*

2. Bir şeyin kiçildilmiş surəti, sxemi, nümunəsi; maket. *Gəminin modeli. Qurğunun modeli.* – *Tamaşaçılar heyran-heyran bunlara baxır və böyük maraqla modellərin uçuşunu gözləyirdilər*. M.Rzaquluzadə.

3. Konstruksiyanın tipi, markası, nümunəsi. *Avtomobilin yeni modeli.*

**MODELÇİ** *is.* Yeni model nümunələri hazırlayan mütəxəssis (bax **model** 1-ci mənada).

**MODELÇİLİK** *is.* 1. Yeni model nümunələri hazırlama.

2. Bir şeyin kiçildilmiş sxemini, nümunəsini düzəltmə; modelqayırma. *Modelçilik dərnəyi.*

**MODELQAYIRAN** b a x **modelçi**.

**MODELLƏŞDİRMƏ** "Modelləşdirmək"-dən *f.is.*

**MODELLƏŞDİRMƏK** *f.* Bir şeyin modelini hazırlamaq. *Paltarı modelləşdirmək.*

**MODEM** *is.* Hesablayıcı elektron maşının və ya abonent məntəqələrinin ikilik siqnallarının rabitə kanallarına göndərilən siqnallara və ya əksinə çevirmək üçün qurğu.

**MODERÁTO** [*ital.*] *mus.* 1. Yavaş, ağır, tələsmədən (musiqi əsərlərinin ifa tempi haqqında).

2. Ağır, yavaş tempdə musiqi əsəri və ya onun bir hissəsi.

**MODERÁTOR** [*lat.* moderator – azaldan] 1. Klavişli (dilli) musiqi alətlərində səsin gücünü tənzim edən alət.

2. Maşının sürətini azaltmaq üçün qurğu.

**MODÉRN** [*fr.* moderne – ən yeni, müasir] 1. XIX əsrin axırı XX əsrin əvvəllərində əsasən memarlıq və tətbiqi incəsənətdə formalizmi, təmtəraqlılığı, süniliyi, eklektizmi ilə fərqlənən bədii üslubun adı.

2. Müasir. *Modern binalar.*

**MODERNİST** [*fr.*] Modernizm tərəfdarı.

**MODERNÍZM** [*lat.*] 1. B a x **modern** 1-ci mənada.

2. İmperializm dövrü burjua incəsənət və ədəbiyyatında realizmə zidd cərəyanların ümumi adı. *İnqilabdan əvvəl rus balet sənətində modernizm və formalizm cərəyanı hakimlik etməkdə idi.* Ə.Bədəlbəyli.

**MÓDUL** *is.* [*lat.*] 1. Riyaziyyatda hər hansı bir mühüm əmsalın və ya kəmiyyətin adı.

2. Bina və tikilinin hissələrini uzlaşdırmaq və ya ona mütənasiblik və ahəngdarlıq vermək üçün inşaatda və ya memarlıqda qəbul edilmiş şərti ölçü vahidi.

**MODULLAŞDIRMA** "Modullaşdırmaq"-dan *f.is.*

**MODULLAŞDIRMAQ** *f. mus*. Bir tondan başqasına keçmək (musiqi səsləri haqqında).

**MOFET** *is.* [*fr.*] Vulkan kraterində və soyumuş lava axınlarında yerləşmiş kanal və çatlardan ayrılan karbon qazı şırnaqları.

**MOGİKAN** *is.* Şimali Amerikada hindu tayfası.

**MOXER** *is.* [*ing.*] Anqor keçisinin tükü və ondan toxunmuş material.

**MOİZƏ** *is.* [*ər.*] 1. B a x **vəz** 1-ci mənada. [Yaşlı kişi:] *Şeyx Yəhyanın dalında namaz qılıb, sonra da moizəsini dinlədim*. S.Hüseyn.

2. Nəsihət, öyüd. [Yusif şahın həvaxahları] *müfəttinlər ilə müqabil durub nəsihət və moizəyə şüru etdilər..* M.F.Axundzadə. // Eyni mənada istehza ilə. [Məsmə:] ..[ərim] *bir axşam mənim üçün bir moizə başladı.* S.Hüseyn. ◻ **Moizə etmək (oxumaq)** *isteh.* – nəsihət vermək, öyüd vermək, uzun danışmaq. *Şeyda* [Arazın] *sözünü kəsdi: – Mən bura moizə etmək üçün gəlmədim.* A.Şaiq. [Vəli:] *Ay Hüseyn, moizə oxuma, tez ol görək, Kəblə Cahangir küçədə gözləyir.* S.Rəhman.

**MÓKKO** [*coğr. is.*-dən] Əla qəhvə növü.

**MOQÁR** *is.* [*ital.*] Taxıllar fəsiləsindən birillik bitki.

**MOQQULDAMA** "Moqquldamaq"dan *f.is.*

**MOQQULDAMAQ** *f.* Moqqultu səsi çıxarmaq (donuz və bəzi başqa heyvanlar haqqında).

**MOQQULTU** *is.* Donuz və bəzi başqa heyvanların çıxardığı səs. *Donuzun moqqultusu.*

**MÓQUR** *is.* Hindistanın qızıl sikkəsi.

**MOL** *is.* Maddə miqdarının vahidi; qram-molekulun qısaldılmış adı.

**MOLBÉRT** [*alm.*] Rəssamın işləməsi üçün üzünə kətan çəkilmiş çərçivəni saxlayan dayaq; rəssam dəzgahı. *Bəhruz molbert arxasında işləyir.* Ə.Məmmədxanlı.

**MOLDAV(AN)** Moldova Respublikasının əsas əhalisini təşkil edən, roman qrupu dillərindən birində danışan xalq və bu xalqa mənsub adam.

**MOLDAV(AN)CA** *sif.* və *zərf* Moldav(an) dilində. *Moldav*(*an*)*ca-rusca lüğət. Moldav*(*an*)*ca danışmaq.*

**MOLÉKUL** [*fr.* molecule – əsli *lat.*] Maddənin bütün kimyəvi xüsusiyyətlərinə malik ən kiçik hissəciyi.

**MOLEKULYÁR** *sif.* [*fr.*] Molekula aid olan. *Molekulyar çəki.* // Molekulların tədqiqi ilə əlaqədar olan. *Molekulyar nəzəriyyə.*

**MOLİBDÉN** [*yun.* molybdos – qurğuşun] 1. Gümüşü-ağ rəngli, çətin əriyən parlaq metal – kimyəvi element.

2. Molibdendən düzəldilmiş. *Molibden məftil.*

**MOLİBDENLİ** *sif.* Tərkibində molibden olan. *Molibdenli polad*.

**MOLLA** *is.* [*ər.*] 1. Rütbəcə axunddan kiçik müsəlman ruhanisi. *Məhəllə mollası. – Sonra da bir tirmə əmmaməli molla gəlib salam verdi.* Mir Cəlal. // Bu zümrəyə mənsub adamların adına əlavə edilən ləqəb. *Əgər xəbər alsan molla Səfini; Oğru, dürüst qarışdırıb kefini.* Q.Zakir. // Keçmişdə, ümumiyyətlə, ruhani zümrəsindən olan adam. *..Kərbəlayı Səlim bir mömin .. adam idi, istədi ki, oğlu molla olub üləma silkinə daxil olsun.* M.F.Axundzadə.

2. Keçmişdə: öz dini məktəbində dərs deyən şəxs. *Səttarla Mahmud kənddə molla Qurbanəlinin yanında oxuyurdular*. P.Makulu.

**MOLLABAŞI¹** *is. köhn.* Baş molla, mollaların başçısı. [Xacə:] *Fərraş göndər, .. molla Yəhyanı və mollabaşı Axund Səmədi mənim hüzuruma çağırsın!* M.F.Axundzadə.

**MOLLABAŞI²** *is. bot*. Ortasında boruvari sarı, yanlarında isə yarpaqvari ağ gülləri olan mürəkkəbçiçəklilər sırasından bir sıra ot bitkilərinin adı.

**MOLLAGUNƏ** *sif.* [*ər.* molla və *fars.* ...gunə] Dindar. *Hacı Hüseyn həmişə təsbeh çevirən, ağzıdualı, mollagunə bir kişi idi.* S.Rəhman. // Özünü mollaya bənzədən, yalançı molla; mollanüma.

**MOLLAXANA** *is.* [*ər.* molla və *fars.* ...xanə] Mollanın dərs dediyi dini məktəb. [Növrəstə:] *Mollaxanada köhnə qayda ilə, köhnə əlifba ilə dərs verirlər.* Ə.Haqverdiyev.

**MOLLALIQ** *is.* 1. Molla vəzifəsi, molla işi. *O vaxt Molla Cəfərqulu hələ mollalıq, mərsiyəxanlıq edərdi.* N.Nərimanov. [Yarməmməd] *atasının mollalığını, anasının falçılığını gizlətdiyi üçün onu maarif şöbəsindən qovmuşdular.* M.İbrahimov.

2. Keçmişdə: mollaxanada dərs demə; mollaxana müəllimliyi. *Tahirzadənin buna haqqı yox idi. Çünki cibində mollalıq kağızı gəzdirmirdi.* Mir Cəlal.

◊ **Mollalıq etmək** *məc. isteh.* – boş nəsihət etmək, göstəriş vermək, ağıl öyrətmək. *..Sən mənə mollalıq eləmə, dəllək, – Ələmdar dönüb dəlləyin üzünə pis-pis baxdı.* S.Rəhimov.

**MOLLANƏSRƏDDİNÇİLƏR** *cəm* “Molla Nəsrəddin” məcmuəsi ətrafında toplanan mütərəqqi, maarifpərvər şair və yazıçılar. *Mollanəsrəddinçilər ilə füyuzatçıların ideya mübarizəsi. Mollanəsrəddinçilərin ədəbiyyat tarixindəki rolu.*

**MOLLANÜMA** [*ər.* molla və *fars.* ...nüma] b a x **mollagunə**. [Yaşlı kişi:] *Mən* “*mollanüma*” *kəlməsinin həqiqi məfhumunu ancaq indi anlamalıyam.* S.Hüseyn. [Hacı:] *Yalançı mollalar indiyəcən şəriəti düz anlatmayıblar. Onlar molla deyil, mollanümalardır.* Mir Cəlal.

**MOLLASAYAQ** b a x **mollagunə**. *Bu kişi mollasayaq adamdı.* (Nağıl).

**MOLLATÜTƏK** *is. zool.* Yayda su üzərində uçan qısaömürlü cücü.

**MOLTANI** *is. dan.* Dinsiz, yolsuz, kafir. *İşin xatirəsi üçün moltanıya dayı deyərlər.* (Ata. sözü). [Axund:] [Qızı] *lap moltanıya da nikah etməyə hazıram.* C.Cabbarlı. // Söyüş mənasında işlədilir. *Moltanı oğlu moltanı.*

**MOLTANILIQ** *is. dan.* Azma, kafirlik.

**MOLYÁR** *is.* Bir litrində həll olunmuş maddənin bir qram molekulu olan məhlul.

**MOLYUSK** *is.* [*rus.*] Yumşaq bədənli onurğasız dəniz heyvanı.

**MOMENT** *is.* [*lat.*] 1. Mexanika və ehtimallar nəzəriyyəsində mühüm rol oynayan riyazi anlayış.

2. An, ləhzə.

**MONÁDA** *is.* [*yun.*] *fəls.* Varlığın struktur vahidini ifadə edən fəlsəfi termin. *Monada Leybnits fəlsəfəsinin əsas anlayışlarından biridir.*

**MONÁRXİST** [*yun.*] Monarxizm tərəfdarı; padşahpərəst.

**MONARXİYA** [*yun.* monarcha – təkhakimiyyətlilik] Dövlətin başında bir nəfərin – padşahın durduğu idarə üsulu, habelə bu üsulla idarə olunan dövlət; padşahlıq, mütləqiyyət. *Konstitusiyalı monarxiya.*

**MONARXİYALI** *sif.* Monarxiya (mütləqiyyət) üsuli-idarəsi olan, padşaha tabe olan. *Monarxiyalı dövlət.*

**MONARXÍZM** [*yun.*] Monarxiyanı (padşahlığı) bərqərar edib saxlamaq məqsədini daşıyan mürtəce siyasi cərəyan; padşahpərəstlik.

**MONASTIR** [*yun.*] 1. Rahib və ya rahibələrin, torpaq və kapitala malik kilsə – təsərrüfat təşkilatından ibarət dini icması. *Kişi monastırı. Qadın monastırı. – Çünki həp bəhs edər manastırdan; Ərə getmək ölümdür onca, inan!..* H.Cavid.

2. Bu icmaya məxsus kilsə, yaşayış binaları və ərazi.

**MONİST** [*yun.*] Monizm tərəfdarı.

**MONİSTİK** *sif.* [*yun.*] Monizmə aid olan, monizmlə əlaqədar olan. *Monistik fəlsəfə.*

**MONİTOR**[1] *is.* [*ing.*] Orta və ali məktəblərdə sinif başçısı, sinif nümayəndəsi, qrup başçısı.

**MONİTOR**[2] *is.* [*ing.*] Zirehli döyüş gəmilərinin ilk tiplərindən biri.

**MONİTOR**[3] *is.* [*ing.*] Video nəzarət qurğusu.

**MONİTORİNQ** *is.* [*ing.*] Nəzarət, nəzarət etmək.

**MONÍZM** [*yun.* monos – bir] Bütün varlığın əsasını yalnız bir şey – ya materiya və yaxud da ruh təşkil etdiyini qəbul edən fəlsəfi nəzəriyyə (*dualizm* ziddi).

**MONQOLLAR** *is.* Monqolustan Xalq Respublikasının və Çin Xalq Respublikasında

Daxili Monqoliya Muxtar Vilayətinin əsas əhalisini təşkil edən xalq və həmin xalqa mənsub adam. *Köhnə monqol əlifbası. XVI əsr – XVII əsrin əvvəllərində monqollar lamaizmi qəbul etmişdilər. Çingiz xanın hakimiyyəti altında yaradılmış vahid dövlət çərçivəsində monqol xalqının təşəkkülü başa çatmışdır.*

**MONQOLCA** *sif.* və *zərf* Monqol dilində. *Monqolca-rusca lüğət. Monqolca yazmaq.*

**MONQOLŞÜNAS** *is.* Monqolşünaslıq mütəxəssisi.

**MONQOLŞÜNASLIQ** *is.* Monqolların dil, yazı, mədəniyyət və tarixini öyrənən elmlərin məcmusu.

**MONÓKL** [*fr.* əsli *yun.* monos – tək və *lat.* oculus – göz] Eynək və ya pensne əvəzinə göz çuxuruna qoyulan bir göz üçün dairəvi optik şüşə – tək gözlük.

**MONOQRÁM** [*yun.* monos – tək və gramma – hərf] Bir neçə hərfin bir-birinə keçirilməsindən ibarət hərf hörgüsü. *Portfel üzərində monoqram.*

**MONOQRAFİK** *sif.* [*yun.*] Monoqrafiya mahiyyəti daşıyan, monoqrafiya şəklində yazılmış. *Monoqrafik tədqiqat.*

**MONOQRÁFİYA** [*yun.* monos – tək və grapho – yazı] Bir mövzunun, bir məsələnin öyrənilməsinə həsr olunmuş tədqiqat əsəri. *M.F.Axundzadə haqqında monoqrafiya.*

**MONOLİ́T** [*yun.* monos – tək və lithos – daş] 1. Bütöv və böyük daş qaya, bütöv daş. // Bütün daşdan yonulmuş hər hansı bir şey.

2. *Sif. mənasında. məc.* Sarsılmaz, bütöv, möhkəm, yekparə. *Xalqın monolit birliyi.*

**MONOLİTLİK** *is.* Sarsılmazlıq, möhkəmlik, bütövlük, yekparəlik.

**MONOLÓQ** [*yun.* monos – tək və logos – nitq] Başlıca olaraq dramada aktyorun özünə, yaxud tamaşaçılara xitabən söylədiyi sözlər – nitq. “*Ölülər*” *əsərində İskəndərin monoloqu. – Salon səssiz bir hal aldı, hərəkətdən əsər yox; Səhnədəki oynaq bir gənc söyləyirdi monoloq.* S.Vurğun. [H.Ərəblinski] *qalxıb .. səmimi səslə öz monoloqunu deməyə başladı.* S.Rəhman. // Təklikdə öz-özünə söylənən nitq, yaxud bir adamın dinləyicilərə xitabən söylədiyi uzun nitq.

**MONOPLÁN** [*fr.* əsli *yun.* monos – tək və *lat.* planum – səth] Bir cüt qanadı olan təyyarə.

**MONOTEİ́ST** [*yun.*] Monoteizm tərəfdarı.

**MONOTEÍZM** [*yun.* monos – bir və theos – Allah] Dünyanın bir Allah tərəfindən yarandığını qəbul edən din; təkallahlılıq.

**MONOTİP** [*yun.* monos – bir və typos – çap] *köhn.* Naboru ayrı-ayrı literlərdən ibarət sətirlər şəklində töküb yığan mətbəə maşını.

**MONOTİPÇİ** *is. köhn.* Monotipdə işləyən mürəttib.

**MONPASI** [*fr.*] Müxtəlif rəngli və formalı xırda, bərk konfet (nabat) növü. *Bir qutu monpası.*

**MONTÁJ** [*fr.*] 1. Maşınların, binaların, sənaye müəssisələrinin və s.-nin müəyyən plan və çertyojlar əsasında quraşdırılıb qurulması. *Mingəçevirlilər illik montaj və inşaat işləri planlarını qurtarmaq üzrə idilər.* Ə.Sadıq.

2. Çəkilmiş filmin, yaxud ədəbi və ya musiqi əsərlərinin ayrı-ayrı parçalarının bədii və məna cəhətdən bir tam halında bir araya toplanması. *Filmin montajı.* // Bu yolla tərtib olunmuş film, şəkil, əsər. *Ədəbi montaj. Musiqi montajı.*

**MONTAJÇI** *is.* Montaj mütəxəssisi; quraşdırıcı. *Montajçılar briqadası. – ..Atalar deyib ki, ehtiyat igidin yaraşığıdır. Bu söz, bizə, biz montajçılara daha çox aiddir.* Mir Cəlal.

**MONTYÓR** [*fr.* monteur] Elektrik avadanlığı işləri mütəxəssisi; montajçı. *Elektrik montyoru. Maşın montyoru.* – [Oğlanın] *sənətinə həvəsi var idi. O, montyor idi.* Mir Cəlal. *Qız Astarada montyor işləyirdi.* Ə.Sadıq.

**MONTYORLUQ** *is.* Montyorun sənəti, peşəsi. *..Dursun montyorluğa da qızlardan şagird qoydu.* Ə.Əbülhəsən.

**MONUMÉNT** [*lat.*] b a x **abidə** 1-ci mənada.

**MONUMENTÁL** *sif.* [*lat.*] 1. Əzəmətli, möhtəşəm. *Monumental bina. Monumental abidə.*

2. *məc.* Məzmunca dərin, əsaslı, sanballı. *Monumental əsər. Monumental opera. – Oratoriya – simfonik orkestr, xor və solistlər*

*üçün bəstələnən çoxhissəli monumental və sanballı musiqi əsəridir*. Ə.Bədəlbəyli.

**MONUMENTALLIQ** *is.* Əzəmətlilik, möhtəşəmlik. *Binanın monumentallığı.*

**MOPÉD** *is.* Motorlu velosiped.

**MOR**[1] *sif.* Bənövşəyi rəng. *Mor parça. – Aşiqəm bu mor dağların; Baharına, yazına mən*. S.Rüstəm. *Onun mor rəngli gözəl gözlərinin gülüşündə nə isə sirayətedici dərin və xoş bir ifadə var idi.* İ.Əfəndiyev. *Gündoğan tərəfdəki .. buludlar mor, pənbə, laciverd rənglərə boyanır*(*dı*). M.Rzaquluzadə.

**MOR**[2] *is. köhn.* Xışın bir hissəsi.

**MOR**[3] *sif.* Kül ilə kömürün qarışığından alınan tünd boz rəng.

**MORATÓRİUM** [*lat.* moratorius – yubadan] *iqt.* Hər hansı fövqəladə vəziyyət (müharibə, böhran, təbii fəlakət və s.) ilə əlaqədar olaraq hökumətin göstərişi ilə borcların ödənilməsinin təxirə salınması.

**MORDVA** Mordoviya Respublikasının əsas əhalisini təşkil edən xalq və bu xalqa mənsub olan adam. *Mordvaların adları ilk dəfə VI əsr mənbəyində çəkilir.*

**MORDVACA** *sif.* və *zərf* Mordva dili, mordva dilində. *Mordvaca kitab. Mordvaca danışmaq.*

**MORFÉM** [*yun.* morphe – forma] *dilç.* Sözün leksik və ya qrammatik mənası olan hissəsi (kök, şəkilçi, yaxud önşəkilçi).

**MÓRFİ** [yunan əsatirində yuxu allahı Morpheios-un adından] Xaşxaş şirəsindən hazırlanan ağrıkəsən və yuxugətirən narkotik maddə (dozadan artıq qəbul etdikdə zəhər kimi təsir edir). *Xan xüsusi otağından çıxdı, .. xəstə olduğunu, hazırda doktor ona morfi vurduğunu söylədi.* M.S.Ordubadi.

**MORFİNİST** [*yun.*] Morfi düşkünü, morfinizmə mübtəla olmuş adam.

**MORFİNÍZM** [*yun.*] Morfi düşkünlüyü, morfi mübtəlalılığı (narkomaniya növlərindən biri).

**MORFOLÓGİYA** [*yun.* morphe – forma və logos – təlim] 1. Orqanizmlərin, mineral maddələrin, torpaqların quruluşu haqqında elm.

2. *dilç.* Hər hansı bir dildə söz formalarının dəyişməsi sistemi, habelə qrammatikanın sözlərin formalarını öyrənən şöbəsi. *Qrammatikanın morfologiya bəhsi.*

**MORFOLOJİ** *sif.* [*yun.*] Morfologiyaya aid olan. *Morfoloji təhlil. Sözün morfoloji quruluşu.*

**MORFÓLOQ** [*yun.*] Morfologiya mütəxəssisi.

**MORFONOLÓGİYA** [*yun.* morphe – forma, phone – səs və logos – təlim] *dilç.* Dilçiliyin fonologiya ilə morfologiyanın əlaqəsini, morfemlərin fonem tərkibini, onların sıralanma qanunlarını öyrənən bəhsi. *Morfonologiyanın obyekti və təhlil metodu. Türk dillərinin morfonologiyası.*

**MORFONOLOJİ** *sif.* [*yun.*] *dilç.* Morfonologiyaya aid olan. *Sözün morfonoloji tərkibi. Morfonoloji prinsipə görə yazılan sözlər. – Azərbaycan dilinin morfonoloji ölçüləri çox güclüdür və bu güc qarşısında qondarma qaydalar tab gətirə bilmir.* F.Ağasıoğlu.

**MOROJNÁ** [*rus.* мороженое] b a x **dondurma**.

**MORS** [*rus.*] Meyvə və giləmeyvə şirəsindən hazırlanan sərinlədici içki. *Alma morsu.*

**MORTÍRA** [*holl.*] Gödəklüləli top. *Sahil mortirası.*

**MORUQ** *is. bot.* Giləmeyvəli kol-bitki və onun ətirli, şirin, ağ və ya qırmızı meyvəsi. *Oğul-uşaq zoğal, fındıq, moruq dərməyə gedərkən, Kərim baba da sıradan qalmazdı.* A.Şaiq. *Mənə, qızıl söyüd çubuğundan hörülmüş səbətdə; Moruq gətirin!* R.Rza. // Moruqdan hazırlanmış. *Moruq mürəbbəsi. Moruq şirəsi.*

**MORUQKİMİLƏR** *cəm, bot.* Moruq və bəzi başqa bitkilərin daxil olduğu cins.

**MORUQLUQ** *is.* Moruq bitən yer, çoxlu moruq kolları olan yer.

**MÓRZE** [ixtiraçısının adından]: **Morze aparatı** – Morze əlifbası vasitəsilə siqnallar vermək üçün sadə teleqraf aparatı. **Morze əlifbası** – hərf və rəqəmləri teleqram aparatı ilə vermək üçün şərti işarələr sistemi.

**MORZEÇİ** *is. köhn.* Morze aparatında işləyən teleqrafçı.

**MOSİ** *is.* Afrikada yaşayan xalqlardan birinin adı. *Mosilərin bir hissəsi müsəlmandır.*

**MOTAL** *is.* 1. Pendir, şor və s. saxlamaq üçün xüsusi surətdə hazırlanmış qoyun və ya keçi dərisi. *Motaldan şor çıxarmaq. – Məs-*

*cidin alçaq qapısından hamballar dalında motal və qeyri baqqal şeyləri çıxardırdılar.* Çəmənzəminli. *Payızqabağı* [Murad bəyin] *evində motal motala söykənirdi.* Qantəmir. ☐ **Motal papaq** – qoyun dərisindən evdə tikilən iri papaq. [Rəiyyətin] *isti-soyuqdan saxlayan motal papağı, ətəyi büzməli arxalığı var idi.* S.Rəhimov. *..Arabanın çağları arasından Əlləzoğlunun motal papağı qaralırdı.* İ.Hüseynov. **Motal pendiri** – motalda saxlanılan pendir. *Süfrədə hər şey vardı: camış qaymağı, beçə balı, inək yağı, üzlü motal pendiri, təndir çörəyi, qənd, şəkər.* Ə.Vəliyev. **Motal tutmaq** – saxlamaq üçün pendiri, şoru duzlayıb motala doldurmaq. [Qurbanəli:] *Biriki motal tutmuşdum, onu da satıb özümə yapıncı almışam.* N.Vəzirov.

2. *dan.* İri, şişman, piyli (qarın haqqında).

**MOTALQARIN** *sif. dan.* İri, şişman qarnı olan, qarnı motala oxşayan. *Motalqarın adam.*

**MOTALPAPAQ(LI)** 1. *sif.* Motal papaq geyinmiş, başında motal papaq olan. *Motalpapaqlı kəndli bir söz deməyib, vaqon biletçisinin göstərdiyi skamyada .. yer tutdu.* T.Ş.Simurq. *..Motalpapaq iki kəndçi çiyinlərində xurcun, gəlib mənim yanımda dayandılar.* Qantəmir. // İs. mənasında. *Kostyumlu, qalstuklu, üzü təmiz qırxılmış adamlarla yanaşı, motalpapaqlılar, üzünü tük basmış, saçsaqqalı bir-birinə qarışmışlar da vardı.* M.İbrahimov.

2. *is.* 1920-ci il aprel inqilabından əvvəl kəndliyə verilən təhqiramiz ad. [Naçalnik:] *Mahmud bəy, nə kömək? İgidlərə bax! Bəylərə motalpapaq?* S.Rüstəm.

**MOTÉL** *is.* [*ing.*] Avtoturistlər üçün hər cür xidmət göstərən mehmanxana.

**MOTÍV** [*fr.* motif] Musiqi və ya başqa sənət əsəri mövzusunun əsas ünsürü. *Povestin əsas motivi. – İntim lirika yenə qüvvətli vətənpərvərlik motivlərilə çarpazlaşır.* M.Hüseyn. *C.Məmmədquluzadənin istər jurnalistlik, istərsə ədəbi-dramaturji yaradıcılığının əsas motivləri geriliyə, mövhumata qarşı mübarizədir.* M.İbrahimov.

**MOTMOTU** *is. bot*. Turşaşirin meyvəsi olan kol-bitki və bu bitkinin meyvəsi.

**MOTODRÓM** [*lat.* motor və *yun.* dromos] Motosiklet yarışı və sınağı üçün yer – meydan.

**MOTÓR** [*lat.* motor – hərəkətə gətirən] Hər hansı enerjini mexaniki enerjiyə çevirən maşın; mühərrik. *Təyyarə motoru. Motora yağ tökmək.* – [Murad] *ömrünün bir qismini Xəzər dənizində mexanikliklə keçirdiyi üçün motor işlətməyi bilirdi.* S.Hüseyn. *Şofer maşını işə salanda motorun gurultusu top gülləsi kimi Rüstəmin başında partladı.* M.İbrahimov.

**MOTORÇU** *is.* Motor işlədən, motora baxan fəhlə. [Tayavuranı] *bir nəfər motorçu idarə edir*. (Qəzetlərdən).

**MOTORÇULUQ** *is.* Motorçu işi, motorçu sənəti. *Motorçuluq kursu.*

**MOTORXANA** *is.* [*lat.* motor və *fars.* ...xanə] Motorların yerləşdirildiyi yer, bina. *Əli ani olaraq düşünür və motorxanaya doğru yollanır.* M.İbrahimov. *Operator otağının aşağı mərtəbəsi motorxana idi.* H.Seyidbəyli.

**MOTORİST** [*lat.*] b a x **motorçu**.

**MOTORQAYIRAN** *sif.* Motor istehsal edən. *Motorqayıran zavod.*

**MOTORLAŞDIRILMA** "Motorlaşdırılmaq"dan *f.is.*

**MOTORLAŞDIRILMAQ** *məch.* Motorlarla təchiz edilmək, motor tətbiq olunmaq.

**MOTORLAŞDIRILMIŞ** *f.sif.* Motorlarla təchiz edilmiş. *Motorlaşdırılmış diviziya. Motorlaşdırılmış alay.*

**MOTORLAŞDIRMA** "Motorlaşdırmaq"-dan *f.is.* Xalq təsərrüfatında mühərriklərin geniş surətdə tətbiqi və istifadə olunması, heyvan qüvvəsinin mühərriklərlə – avtomobillərlə, traktorlarla və s. ilə əvəz edilməsi.

**MOTORLAŞDIRMAQ** *f.* Motorlarla təchiz etmək, motor tətbiq etmək (b a x **motorlaşdırma**).

**MOTORLU** *sif.* Motoru olan, motorla işləyən, motorla hərəkətə gətirilən. *Motorlu balıqçı gəmiləri. Motorlu velosiped.*

**MOTORÓLLER** [*ing.*] Daha kiçik çarxlı motosiklet növü.

**MOTORSUZ** *sif.* Motoru olmayan, motorla deyil, başqa vasitələrlə hərəkətə gətirilən. *Motorsuz qayıq.*

**MOTOSİKL, MOTOSİKLET** [*fr.* motocycle] Daxili yanacaq mühərriki ilə hərəkətə gətirilən, velosipedə oxşayan, əksərən yanına qoşulan arabası olan ikiçarxlı maşın.

*Çox çəkmədən motosikl .. bərkdən guruldayıb susdu.* B.Bayramov. *Uzaqdan sürətlə gələn bir motosiklet birdən* [partizanların] *lap yaxınlığında dayandı.* S.Vəliyev.

**MOTOSİKLETÇİ** *is.* Motosiklet sürən, motosikletdə gedən, motosiklet idmanı ilə məşğul olan adam. *Motosikletçilərin yarışı.*

**MOTOVÓZ** [*lat.* motor və *rus.* воз] Daxili yanacaq mühərriki ilə hərəkət edən kiçik lokomotiv. *Gecələr maşınların, motovozların səsi; Uğuldayır körpülər üzərində sübhədək.* Ə.Cəmil.

**MOTOYÜRÜŞ** *is.* Dərə-təpə yerlərdə motosikletlə qaçışmadan ibarət idman növü. *Motoyürüşdə qalib gəlmək.*

**MOVULDAMA** "Movuldamaq"dan *f.is.*

**MOVULDAMAQ** *f.* Movultu səsi çıxarmaq (mal-qara haqqında). *İnək movuldayır.*

**MOVULTU** *is.* Mal-qaranın çıxardığı səs. *Buğanın movultusu.*

**MOYVA** *is.* [*fincə*] Uzunsov balıq cinsi.

**MOZAİK** *sif.* Mozaikadan düzəldilmiş, mozaikası olan, mozaika ilə bəzədilmiş. *Mozaik şəkil. Mozaik döşəmə.*

**MOZÁİKA** [*fr.* mosaique] 1. Sement və ya mastika təbəqəsi üzərinə yapışdırılmış əlvan şüşə, mərmər, mina, daş və s. parçalarından düzəldilmiş şəkil və ya naxış. // *top.* Belə şəkil və ya naxış üçün işlədilən şüşə, mərmər, rəngli daş və s. parçaları.

2. Belə şəkil və ya naxış düzəltmə sənəti. *Mozaika ilə məşğul olma.*

**MOZAİKAÇI** *is.* Mozaika ustası.

**MOZALAN** *is. zool.* Sürfələri heyvanların bədənlərində tüfeyli kimi yaşayan ikiqanadlı cücü, iri milçək.

◊ **Mozalan tutmuş dana kimi** – birdən, durmadan, sıçrayaraq. [Hümmət:] *..Kürəyindən tər süzüləndə mozalan tutmuş dana kimi götürülərək hardan gəlib, birbaş ora!* B.Bayramov.

**MÖCÜZ** b a x **möcüzə**. *Möcüzi-ləli-ləbin həzrəti İsa nə bilir; Nazi-əndamını Şirinü Züleyxa nə bilir.* Q.Zakir. *Möcüzlər yaradır alnımdakı qan-tərim; Dünyanın hər yerində söylənməkdə hünərim.* Ə.Cavad.

**MÖCÜZƏ** *is.* [*ər.* möcizə] 1. Dini xurafata və mifik təsəvvürlərə görə, xariqüladə, fövqəltəbii qüvvələrin təsiri ilə baş verən hadisə. [Bəy:] *Avam kəndlinin içinə möcüzə xəbəri yayılsa, əkini buraxaraq qopub gələcək..* Çəmənzəminli. [Məşədi Əhməd] *cavanlıqda Xorasan ziyarətinə gedərkən orada eşitdiyi bir möcüzədən bəhs edərdi.* S.Hüseyn.

2. Qeyri-adiliyi ilə heyrət doğuran, qeyri-adi bir şey. *Bu, adama lap möcüzə kimi gəlir.* – [Səba xanımın] *zahiri gözəlliyi təbiətin möcüzələrindən idi.* M.S.Ordubadi. *..Əməyin möcüzələr yaratmağa qadir olduğuna inanan, taleyin ağası olan insanların inamı vardır.* M.İbrahimov.

**MÖCÜZƏLİ** *sif.* Möcüzələr yaradan, xariqüladə, ecazkar. [Nəsir Muradəliyə:] *Yeni nəslin bu möcüzəli işinə necə baxırsan?* B.Bayramov.

**MÖHKƏM** *sif.* [*ər.*] 1. Davamlı, bərk. *Möhkəm sədd. Möhkəm divar. Möhkəm ip. Möhkəm taxta.* // *Zərf mənasında*. Bərk-bərk, kip. *İpləri möhkəm bağlamaq.*

2. Sağlam, davamlı, dözümlü, qüvvətli. *..Qaraş möhkəm və sağlam idi.* M.İbrahimov. // *Zərf mənasında.* Bütün gücü ilə, bacardığı qədər; bərk. *Möhkəm ilişdirmək. – Batalyon komissarı .. döyüşçünün əlini möhkəm sıxıb onu azad etdi.* Ə.Vəliyev. [Qız] *yastığının altında gizlətdiyi baltanı əlində möhkəm sıxaraq yerindən sıçradı.* H.Seyidbəyli.

3. Səbatlı, mətin, dönməz, yenilməz. [Elçin:] *Nə boran, nə qar, nə də şaxta* [neftçilərin] *möhkəm iradəsini qıra bilməz.* Z.Xəlil. // Mətanətli, iradəli. *Möhkəm adam. – ..Ağıllı, qonur gözləri onun möhkəm xasiyyətli olduğunu göstərirdi.* S.Vəliyev. *Hər şeydə möhkəm, sözünün üstündə duran, inadcıl, amansız olan Baxış bəyin bir zəif tərəfi vardı.* Ə.Abasov. ☐ **Möhkəm dayanmaq** – səbat göstərmək, inad göstərmək, bərk dayanmaq. [Əmrulla:] *Başınıza dönüm, möhkəm dayanın, yoxsa bütün şəhərdə biabır olarıq.* C.Cabbarlı. *Elçin sözünün üstündə möhkəm dayandı.* M.Rzaquluzadə. // Sədaqətli, etibarlı, sadiq. *İndi isə buralarda* [Malikin] *Sona kimi çoxlu sadiq və möhkəm dostları vardır.* M.İbrahimov.

4. Sarsılmaz, alınmaz, yenilməz. *Möhkəm qala. Möhkəm yerdə məskən salmaq.*

5. Güclü, şiddətli, bərk. *Möhkəm qar yağır. Möhkəm soyuqdur.* // *Zərf mənasında.* Çox,

olduqca, hədsiz, həddindən artıq. *Möhkəm acmışam*. // Ümumiyyətlə, bir şeyin şiddətini, dərəcəsini bildirir. *Möhkəm tapşırmaq. Möhkəm xəstələnmək.* // Doyunca, kifayət qədər. *Yox, yox, lazım deyil. Lap möhkəm yedim, – deyə Əlyarov boşqabın qırağından yapışıb buraxmadı.* M.Hüseyn. *Yas yerində qarnını möhkəm doyuran Hümmətlə Qarakişi öz həyətlərinə doğru gedirdilər.* B.Bayramov.

6. *zərf* Əməlli-başlı, əsaslı, layiqli, lazımi. [Kəndli:] *Qərəz, bir qədər yas saxladıqdan sonra, kiçik oğluna möhkəm bir toy elədi.* (Nağıl). *Qəbul olundu ki, inşaat institutunda rəhbər işçilərə möhkəm əl gəzdirilsin*. Mir Cəlal.

**möhkəm-möhkəm** *zərf* Bütün gücü ilə, var qüvvəsi ilə, möhkəm, bərk-bərk. *Möhkəm-möhkəm tutmaq. – Həbib isə körpə qızı möhkəm-möhkəm bağrına basıb danışıqlara ciddi qulaq asırdı.* Ə.Vəliyev. [Rüstəm:] *Mən inanıram, qoy uşaq da, böyük də bu işdən möhkəm-möhkəm yapışsın.* S.Rəhimov.

**MÖHKƏMCƏ** *zərf* Möhkəm surətdə, möhkəm-möhkəm, çox bərk. *Möhkəmcə ilişdirmək. – Balaxanım yumruğunu düyünləyib irəliyə cumdu və düz Dadaşın burnunun qabağında möhkəmcə silkələdi.* S.Rəhimov. // *Sif. mənasında.* Möhkəm, bərk, davamlı. *Möhkəmcə bir ip.*

**MÖHKƏMLƏNDİRİLMƏ** "Möhkəmləndirilmək"dən *f.is.*

**MÖHKƏMLƏNDİRİLMƏK** *məch.* Möhkəm hala gətirilmək, möhkəm edilmək, bərkidilmək.

**MÖHKƏMLƏNDİRMƏ** "Möhkəmləndirmək"dən *f.is.*

**MÖHKƏMLƏNDİRMƏK** b a x **möhkəmlətmək**. *Müəllim dostluğu möhkəmləndirmək üçün bir gün Qaçayın bütün ailəsini qonaq çağırdı.* Ə.Vəliyev.

**MÖHKƏMLƏNMƏ** "Möhkəmlənmək"dən *f.is.*

**MÖHKƏMLƏNMƏK** *f.* 1. Möhkəm hala gəlmək, möhkəm olmaq, möhkəmləşmək. // Bərkimək, sərtləşmək. *Sümüyü möhkəmlənmək.*

2. *məc.* Cismən və ruhən sağlamlaşmaq, qüvvətlənmək, bərkimək, möhkəmləşmək. *İdman nəticəsində bədən möhkəmlənir.*

3. *məc.* Qüvvətlənmək, güclənmək. *Təşkilat günü-gündən möhkəmlənir.*

**MÖHKƏMLƏŞDİRMƏ** "Möhkəmləşdirmək"dən *f.is.*

**MÖHKƏMLƏŞDİRMƏK** *f.* Daha möhkəm etmək; möhkəmləndirmək.

**MÖHKƏMLƏŞMƏ** "Möhkəmləşmək"dən *f.is.*

**MÖHKƏMLƏŞMƏK** *f.* Daha da möhkəm olmaq; möhkəmlənmək. *Əmək intizamı möhkəmləşir*.

**MÖHKƏMLƏTMƏ** "Möhkəmlətmək"dən *f.is.*

**MÖHKƏMLƏTMƏK** *f.* 1. Möhkəm etmək, davamlı hala salmaq; bərkitmək. *Düyünü möhkəmlətmək. Vinti burub möhkəmlətmək.* – [Kamran:] *Qırılan zəncirləri bir də möhkəmlətmək olmaz*. H.Nəzərli.

2. Müdafiə qüvvəsini artırmaq; alınmaz, keçilməz, möhkəm hala gətirmək; bərkitmək. *Müdafiəni möhkəmlətmək. Səngərləri möhkəmlətmək.*

3. *məc.* Cismən və ruhən bərkitmək, sağlamlaşdırmaq, qüvvətləndirmək. *Vaxtında yemək və istirahət etmək bədəni möhkəmlədən şərtlərdən biridir.*

4. *məc.* Möhkəm etmək, sarsılmaz hala gətirmək; ciddiləşdirmək. *İntizamı möhkəmlətmək.* – [Rüstəm kişi] *briqada və manqaları möhkəmlətdi, uçot işlərini qaydaya saldı*. M.İbrahimov.

**MÖHKƏMLİK** *is.* 1. Möhkəm şeyin halı; bərklik, davamlılıq. *Materialın möhkəmliyi*.

2. Möhkəm olma; dözümlülük, səbatlılıq, mətinlik, iradəlilik. *Mədəndə işləyən adamlardan ilk növbədə möhkəmlik tələb olunur*. M.Hüseyn.

3. Yenilməzlik, alınmazlıq, sarsılmazlıq. *Qalanın möhkəmliyi. Arxanın möhkəmliyi*.

4. Sağlamlıq, qüvvətlilik, davamlılıq. *Bədənin möhkəmliyi.*

**MÖHLƏT** *is.* [*ər.*] 1. Vaxt vermə; bir işin görülməsi, yaxud vəd olunan bir şeyin yerinə yetirilməsi üçün verilən vaxt, müddət; icazəli vaxt. [Mahmud bəy:] *Əşi, möhlət nədir, iş işdən keçib; Səlim bəy kişidir, möhkəm and içib*. S.Rüstəm. // Ümumiyyətlə, bir işi görmək üçün tələb olunan vaxt, müddət. *Gərək* [pasport] *çıxardam, bu da bir-iki həftə möhlət*

*istəyir.* Ə.Haqverdiyev. [Vəzir:] *Əmir sağ olsun, sən Zeyddən qırx gün möhlət istə, bəlkə bu qırx günün ərzində bir əlac tapaq!* Ü.Hacıbəyov. ☐ **Möhlət almaq** – bir işi yerinə yetirmək üçün vaxt almaq. [Sara bibi:] *Mən də on beş gün möhlət alıb gəlmişəm*. Qantəmir. **Möhlət vermək** – 1) bir işin müəyyən müddətdə yerinə yetirilməsi üçün vaxt vermək; 2) fürsət vermək, vaxt vermək, imkan vermək. *Göz yumub aləmdən, istərdim açam rüxsarinə; Canım aldın, göz yumub açınca möhlət vermədin*. Füzuli. [Əbdürrəhman bəy:] *Arvad, sən atanın goru, ikicə dəqiqə mənə möhlət ver, gedəcəyəm.* N.Vəzirov. [Hacı Saleh:] *Sənin beş min manatını hazır etmişəm, ancaq altı yüzünə bir həftə möhlət ver.* S.S.Axundov.

2. *rəs*. Bir işi müəyyən vaxta qədər təxir etmə. *Orduya çağırışdan möhlət haqqında əmr.*

**MÖHNƏT** *is.* [*ər.*] 1. Zəhmət, əziyyət, qayğı, ağırlıq, dərdi-sər. *Möhnəti artmaq*. – Böyükxanım:] *Qulamxan, bundan sonra belini bərk bağla! İndi iki evin möhnəti düşdü sənin belinə*. M.S.Ordubadi. ☐ **Möhnət çəkmək** – əziyyət çəkmək, zəhmət içində olmaq; dərdi-sər çəkmək.

2. Dərd, qəm, qüssə, kədər. *Aclıq bir il gedər, möhnət min il*. (Ata. sözü). *Gərçi, ey dil, yar üçün üz verdi yüz möhnət sana.* Füzuli. *Düşmüşəm dərdinə, çox möhnətü qayğu çəkirəm; Deyə bilməm sənə, amma elə gizli çəkirəm*. M.P.Vaqif. *Əfsus, nə şadlıq, nə qəm və möhnət; Açmaz o gözləri dübarə heç vaxt*. A.Səhhət. *Dedim öz-özümə: – Heç kəs dünyada; Görməsin üzünü möhnətin, qəmin*. H.Arif. ☐ **Möhnətə salmaq** – qəmə-qüssəyə, kədərə düçar etmək. *Zəmanə saldı əcəb möhnətü məlalə məni*. X.Natəvan. [Afət:] *Baş hərəmlik məni saldı möhnətə; Həsrətəm atəşin bir məhəbbətə*. M.Rahim. // Müsibət, bəla, afət. *Mən aşıq mənə sarı; Baxgilən mənə sarı; Hər yerdə möhnət olsa; Üz verər mənə sarı.* (Bayatı). *Rövşən etməz, yüz min günəş bərq edə; Bu möhnətə qarələnmiş könlümü*. M.V.Vidadi. *Ölkələr fəth edən böyük qeysər; Çoxunu qurtarıb o möhnətdən*. A.Şaiq.

**MÖHNƏTKEŞ** *sif.* və *is.* [*ər.* möhnət və *fars.* ...keş] Möhnət çəkən; möhnətli, qayğılı, qəmli, kədərli. *Fərhada*, *Şirinə, yüz möhnətkeşə; Behiştə, qılmana verməræm səni*. Aşıq Əli.

**MÖHNƏTLİ** *sif.* Dərdi-kədəri olan; qəmli, qüssəli, kədərli, əziyyətlə dolu. *Möhnətli adam. Möhnətli günlər. – Bu möhnətli ana Cəmilin üzündən öpüb getdi*. T.Ş.Simurq. *Səhər kimi açılır; Möhnətli üzlər indi.* R.Rza.

**MÖHRƏ** *is. məh*. Gil palçıqdan tikilmiş divar, hasar. *Onlar bağçanın içi ilə ötüb, möhrədən aşıb vağzala keçdilər.* Mir Cəlal.

**MÖHRƏLİ** *sif. məh*. Möhrədən tikilmiş. *O, möhrəli evinə gəlir. Tutunu əli qoynunda görür*. S.Rəhimov.

**MÖHTAC** *sif.* 1. Bir şeyə ehtiyacı olan, bir şeyə hacəti olub onu aradan qaldıra bilməyən. *Möhtac adam. – Dedim: – Yol gəlmişəm, özüm də acam; Doğrusu, bir parça yemə möhtacam.* S.Vurğun. // *İs. mənasında*. Köməyə, maddi yardıma ehtiyacı olan adam; yoxsul, kasıb, fağır. ..*Biz möhtacları da görürük, sizi də*. Mir Cəlal.

2. Xəbər şəkilçisi ilə: **möhtacdır** – ehtiyacı var, ...ehtiyac hiss edir. *O, yaxşı bir müəllimə möhtacdır. – İnsan ömrünün ibtidasından intəhasına qədər möhtacdır təhsiliüluma.* "Əkinçi".

◊ **Möhtac qalmaq** – b a x **möhtac olmaq**. **Möhtac qılmaq** – b a x **möhtac etmək**. *Çoxların qılıbsan çörəyə möhtac*. Q.Zakir. **Möhtac qoymaq** – b a x **möhtac etmək**. [Kazım:] *Ən böyük igidlik külfəti dosta-düşmənə möhtac qoymamaq imiş.* Çəmənzəminli. **Möhtac etmək** – 1) ehtiyac içində saxlamaq, ehtiyaclı etmək; 2) asılı etmək, tabe etmək. *Salma gəl dərdə məni; Yar, görsən bir də məni; Namərdə möhtac etmə; Kəs qurban mərdə məni.* (Bayatı). *Etməsin Tanrı səni kafərə, yarəb, möhtac!* S.Ə.Şirvani. **Möhtac olmaq** – 1) ehtiyac içərisində olmaq, sıxıntı çəkmək; 2) hər hansı bir şey, xüsusən dolanacaq cəhətdən asılı olmaq, tabe olmaq. [Kəblə Cahangir:] *Al bu saatı, verin, qıfılı açsın, namərdə möhtac olmaqdansa bu yaxşıdır*. S.Rəhman. *İnamla ucaltdıq anamız yeri; Biz möhtac olmadıq dosta, düşmənə.* B.Vahabzadə.

**MÖHTACLIQ** *is.* Möhtac olma, ehtiyaclı olma.

**MÖHTƏKİR** *is.* [*ər.*] Varlanmaq məqsədilə yeyinti və s. zəruri şeyləri ucuz qiymətə alıb saxlayan və sonradan baha qiymətə satan alverçi; ehtikarla məşğul olan adam. *Kəndlilər, zəli kimi qanlarını soran möhtəkirlərdən, sələmçilərdən azad oldular*. – *Təbriz şəhəri böyük taxıl möhtəkirlərinin əli ilə yaradılan süni aclıq dövrü keçirirdi.* P.Makulu.

**MÖHTƏKİRLİK** *is.* Möhtəkirin işi, peşəsi, məşğələsi; ehtikar. *Möhtəkirlik etmək.*

**MÖHTƏRƏM** *sif.* [*ər.*] Hörmətli, əziz, ehtirama layiq. ..*Qara camaatımızın gözünə torpaq səpənləri də tapşırırıq möhtərəm oxucularımıza*. C.Məmmədquluzadə. *Hacı Rüstəm Təzəşəhərdə mötəbər və möhtərəm bir tacir idi.* Ə.Haqverdiyev.

**MÖHTƏRƏMLİK** *is.* Hörmətlilik, ehtiramlılıq, əzizlik, mötəbərlik.

**MÖHTƏŞƏM** *sif.* [*ər.*] Öz əzəməti, böyüklüyü, həşəməti ilə insanı valeh edən; əzəmətli, ehtişamlı. *Möhtəşəm abidə. Möhtəşəm saray*. – *Kainat nə möhtəşəm, təbiət nə gözəl, həyat nə dadlı, insan nə bəxtiyardır!* M.Rzaquluzadə.

**MÖHTƏŞƏMLİK** *is.* Əzəmətlilik, nəhənglik, ehtişamlılıq. *Binanın möhtəşəmliyi.*

**MÖHÜR** *is.* [*fars.*] 1. Üzərində bir idarənin, təşkilatın və ya şəxsin adı həkk olunmuş metal, rezin və s.-dən damğa (bir şeyi təsdiq etmək üçün sənəd, surğuc və s. üzərinə basılır). *İdarənin möhrü*. – *Yazılı məktuba 20 nəfər imza atıb möhrünü basdı.* M.S.Ordubadi. [Sona:] *Şəhər komandanlığının möhrü basılmış kağızlardır*. H.Nəzərli. // Həmin alətin (damğanın) kağız və s. üzərindəki izi, surəti, şəkli. *Arayışın möhrü aydın deyil*. – ..*Gah paketə baxır, gah markaları, poçtun möhrünü gözdən keçirirdi.* Ə.Sadıq. // Hökmdar nişanı, damğası. [Nüşabə:] *Bu Kəyan bayrağı, bu da bir tuğra; Keyqubad möhrü də vurulmuş bura*. A.Şaiq.

2. *dan.* Müsəlmanların müqəddəs saydıqları Məkkə, Kərbəla, Məşhəd kimi yerlərin torpağından düzəldilən və şiələrin namaz zamanı səcdəyə gedərkən alınlarını söykədikləri quru gil parçası. [Güldəstə:] *İstəyirsən* .. *axşamdan sübhədək başını möhrə döy, ondan bir şey çıxmayacaq.* N.Vəzirov. [Rza:] *Atam alnını möhrə qoyub ağlayır, ağlayırdı.* M.İbrahimov.

**MÖHÜRLƏMƏ** "Möhürləmək"dən *f.is.*

**MÖHÜRLƏMƏK** *f.* 1. Hər hansı sənədi təsdiq etmək üçün ona möhür basmaq, möhür vurmaq. *Arayışı möhürləmək. Vəkalətnaməni möhürləmək. Diplomu möhürləmək.*

2. Bir şeyin müəyyən vaxt bağlı qalması üçün ağzına möhür vurmaq, möhür basmaq. *Qapını möhürləmək. Zərfi möhürləmək.* – *Müfəttiş cibindən kəndir çıxarıb, şkafın halqalarından keçirdi, surğuc yandırıb tutdu və möhürləyib qurtardı.* S.Rəhimov.

**MÖHÜRLƏNMƏ** "Möhürlənmək"dən *f.is.*

**MÖHÜRLƏNMƏK** *məch.* 1. Möhür basılmaq, möhür vurulmaq. *Attestat möhürləndi. Protokol möhürləndi.* – *Üç kağız yazdılar, möhürləndi*. Qantəmir.

2. Bir şeyin müəyyən vaxt bağlı qalmağı üçün ağzına möhür vurulmaq, möhür basılmaq. [Daşdəmir:] *İkinci təklif budur ki, anbarın qapısına qıfıl vurulub möhürlənsin!..* B.Bayramov.

**MÖHÜRLƏNMİŞ** *f.sif.* Möhür vurulmuş, möhür basılmış; möhürlü. *Qubernator əlini uzadıb, dörd tərəfi surğucla möhürlənmiş bir paket çıxartdı.* M.S.Ordubadi. *Tez açdılar o qutunun; Möhürlənmiş qapağını*. M.Dilbazi.

**MÖHÜRLƏTMƏ** "Möhürlətmək"dən *f.is.*

**MÖHÜRLƏTMƏK** *icb.* 1. Hər hansı sənədi təsdiq etdirmək üçün ona möhür basdırmaq, möhür vurdurmaq. *Çıxarışı möhürlətmək. Etibarnaməni möhürlətmək*.

2. Bir şeyin müəyyən vaxt bağlı qalması üçün ağzına möhür vurdurmaq, möhür basdırmaq. *Kassanı möhürlətmək*. – [Səttar xan] *Təbrizdə yüzlərlə tacirin hücrəsini və anbarını möhürlətdi*. M.S.Ordubadi.

**MÖHÜRLÜ** *sif.* 1. Üzərində möhür olan, möhür vurulmuş, möhürlənmiş, möhürlə təsdiq edilmiş, möhrü olan. [Həsən paşa] *hamı əhvalatdan hali olandan sonra çıxardıb xotkarın möhürlü naməsini* [məclis əhlinə] *oxudu.* "Koroğlu". ..*Qoca öz sonbeşiyi Əlisanın əsgər geyimli şəklini,* .. *aydın möhürlü fərmanı nəzərdən keçirdi.* S.Rəhimov.

2. Müəyyən vaxt bağlı qalması üçün möhür (surğuc) vurulmuş. *Möhürlü kassa.* – *Gündə Peterburqdan Gorusa möhürlü paket gəlirdi.* S.Rəhimov.

**MÖMİN** *sif.* və *is.* İnandığı dinin (əsasən islam dininin) ehkamlarına ciddi surətdə əməl

edən adam; dindar, dinçi. *Başmaqçı usta Ağabala .. saleh, salim, mömin, Allah bəndəsi bir şəxs idi*. Çəmənzəminli. *Mərhum Zeynəb xanım mömin, müsəlman bir Allah bəndəsi idi.* Qantəmir.

**MÖMİNLİK** *is.* Dindarlıq, dinçilik.

**MÖTƏBƏR** *sif.* [*ər.*] 1. Etibarlı, inanılan, inanıla biləcək, etibar edilən. *Mötəbər mənbələrə görə...* – [Ağa Kərim:] *..Bu saatda hakimi-şər yanında Ağa Mərdandan mötəbər kimsənə yoxdur*. M.F.Axundzadə. *Bir neçə mötəbər, bu işdən xəbərdar adamlar tapılıb*. C.Cabbarlı.

2. Hörmətli, xatiri sayılan, sözü keçən, tanınmış, sözünə və təmizliyinə etibar olunan, nüfuzlu. *Qayda üzrə cıdırdan sonra bayram qurtarar və saraydan .. sərkərdələrə və mötəbər şəxslərə xələt-barat gedirdi*. Çəmənzəminli. // Nüfuzlu, tanınmış. *Şəhərin mötəbər həkimləri çağırıldı, Arzu qıza müalicə edilməyə başlandı*. S.Rəhimov.

**MÖTƏBƏRLİK** *is.* Mötəbər olma; etibarlılıq.

**MÖTƏDİL** *sif.* [*ər.*] 1. Nə az, nə çox; nə çox böyük, nə çox kiçik; orta vəziyyətdə olan; miyanə. *Əndami ayinə, qəddi mötədil; Siyah zülfü qamətinə tən gərək.* M.P.Vaqif.

2. Nə isti, nə soyuq; mülayim, yumşaq (iqlim, hava haqqında). [Cavanşir mahalının] *qışı ilə yazında təfavüt yoxdur, havası mötədil, torpağı ziyadə bərəkətli və hər qisim məhsulat yetirəndir.* F.Köçərli. *Şimalın mötədil və xoş havasından sonra cənubun istisinə dözmək o qədər də asan deyil.* M.İbrahimov.

**MÖTƏDİLLƏŞMƏ** "Mötədilləşmək"dən *f.is.*

**MÖTƏDİLLƏŞMƏK** *f.* Mötədil olmaq; mülayimləşmək, yumşalma. *İyun ayının əvvəlləri idi, hava mötədilləşmişdi.* Ə.Vəliyev.

**MÖTƏDİLLİK** *is.* Mötədil olma; mülayimlik, yumşaqlıq. *Havanın mötədilliyi.*

**MÖTƏRİZƏ** *is.* [*ər.*] Kiçik şaquli xətt şəklində (düz, dairəvi və ya fiqurlu) qoşa durğu işarələrindən biri; həmin şəkildə qoşa riyazi işarələrdən biri. *Kiçik mötərizə. Böyük mötərizə. Mötərizə açmaq. Sözü mötərizəyə almaq.*

**MÖVC** *is.* [*ər.*] *klas.* Dalğa, ləpə. *Ağır-ağır bulud kimi fövclər; Gəlir, verir dərya kimi mövclər.* A.Səhhət. [Xortdan:] *..Suyun mövcləri gəmini qoz qabığı kimi atıb-tuturdu.* Ə.Haqverdiyev. ◻ **Mövc vermək** – dalğalanmaq, ləpələnmək. *Coşdu, dəli könül coşdu; Mövc verdi, kəllədən aşdı.* "Koroğlu". **Mövc vurmaq** – dalğalanıb hərəkətə gəlmək. *Camaat önü alınmış sel kimi meydanda burulub mövc vururdu*. Mir Cəlal. **Mövcə gəlmək** – b a x **mövclənmək**.

**MÖVCİB** *is.* [*ər.*] *klas.* Səbəb, bais. ◻ **Mövcib olmaq** – səbəb olmaq, bais olmaq. *Cahil oğlanların qız toyuna dürtülməsi yetişmiş qızlar tərəfindən .. etiraza mövcib olmazdı.* R.Əfəndiyev.

**MÖVCİBİNCƏ** *qoş. köhn.* Görə, əsasən, binaən. [Şah:] *Qoşunun .. məvacibi qibleyi-aləmin fərmanı mövcibincə və mənim imzam ilə vilayətlərin mədaxilindən həvalə olunur.* M.F.Axundzadə. [Mirzə Məmmədqulu:] *Camaat, bu gün cənab naçalnikin hökmü mövcibincə burada bir siyahi qərar verilib.* C.Məmmədquluzadə.

**MÖVCLƏNMƏ** "Mövclənmək"dən *f.is.*

**MÖVCLƏNMƏK** *f. klas.* Mövcə gəlmək, dalğalanmaq, ləpələnmək. *Düzlərdə əkilmiş taxıl nəsimin qabağında oyan-buyana yatıb dəryatək mövclənirdi.* Ə.Haqverdiyev.

**MÖVCUD** *sif.* [*ər.*] 1. Var olan, göz qabağında olan, hazırda olan. *Mövcud imkanlar daxilində. Mövcud quruluş. – Quşun .. gözəlliyini təsvir etməyə nə mövcud rənglər, nə məlum kəlmələr kifayət etməz*. M.Rzaquluzadə. ◻ **Mövcud olmaq** – var olmaq, olmaq. *Dərya və qeyr yerlərdə mövcud olan sular daima buxar olaraq dövr edən havaya qarışır, yuxarı qalxır, bulud və duman olur.* H.Zərdabi. [Nərgiz:] *Səndən ağılsızlar mövcud olduğu halda, səni axmaq sayırlar, Zərli!* B.Bayramov.

2. **Mövcuddur** şəklində – vardır. [Bağdadda] *minlərcə xəlvətxanalar, meyxanalar və kef yerləri mövcuddur*. M.S.Ordubadi. [Əntərzadə:] *Yoldaşlar, əlbəttə, qüsurlarımız mövcuddur*. Mir Cəlal.

**MÖVCUDAT** *top.* [*ər.* "mövcud" söz. cəmi] Var olan bütün şeylər; varlıqlar, kainat. *Qüvvəyə bağlıdır aləmdə həyat; Qüvvədən nəşət edir mövcudat.* A.Səhhət. *Buludlar yox oldu, mövcudata həyat bəxş edən günün gözəl şüalarını aldıq.* T.Ş.Simurq.

**MÖVCUDİYYƏT** [*ər.*] bax **varlıq** 1-ci mənada.

**MÖVCUDLUQ** *is.* Mövcud olma; mövcudiyyət, varlıq,

**MÖVHUM** *sif.* [*ər.*] Əslində olmayıb xəyala gətirilən, xəyalda törəyən. *Mövhum qüvvələr.* – [Əşrəf] *həm də mövhum bir xəyal deyil, parlaq bir həqiqət qarşısında bulunmuş olurdu.* H.Cavid.

**MÖVHUMAT** *is.* [*ər.* "mövhum" söz. cəmi] 1. Əslində olmayıb xəyala, fikrə gətirilən şeylər; xəyalat.

2. İnsanları cəhalətdə saxlayan dini görüşlər; xurafat, fanatizm. *Mövhumatla mübarizə. – Dini mövhumat insanları daimi bir qorxu altında saxlayır, onların şüurunu kütləşdirir, təşəbbüs və bacarığını əlindən alır.* M.Arif. [Ovçu anasına:] *Mövhumat çəngəlində məhv olan sevgilimin intiqamını almalıyam.* Ə.Məmmədxanlı.

**MÖVHUMATÇI** *is.* və *sif.* Dini mövhumata qapılmış (adam), mövhumata inanan (adam). [Yaşlı kişi:] *..O zaman məni əhatə edən mühit mövhumatçı olduğu kimi, mövhumatçı bir ailənin də tərbiyə edib yetişdirdiyi bir gənc idim.* S.Hüseyn. *..Dürdanə xanım xoştəbiətli, sadəürəkli, nazik, bir qədər mövhumatçı bir adamdı.* Ə.Əbülhəsən.

**MÖVHUMATÇILIQ** *is.* Mövhumata inanma; fanatizm.

**MÖVHUMATPƏRƏST** [*ər.* mövhumat və *fars.* ...pərəst] bax **mövhumatçı**. *Şərqin çürük mövhumatpərəst və dedi-qodulu həyatı* [Məhərrəmi] *sıxdığından bu mühitdən uzaqlaşmaq üçün tədbirlər düşünməyə başladı.* A.Şaiq.

**MÖVQE** *is.* [*ər.*] 1. Yer, məhəl. // Bir şeyin baş verdiyi, olduğu yer.

2. Hər hansı bir adamın cəmiyyətdə, ictimai həyatda yeri, rolu, vəziyyəti. *İctimai mövqe. – Vaqifin də sol yanda əyləşdirilməsi, onun sarayda qazanmış olduğu mövqeyi və hörməti göstərirdi.* Çəmənzəminli. □ **Mövqe tutmaq** – yer tutmaq, əhəmiyyəti olmaq, nüfuz qazanmaq. // Vəzifə, rütbə, dərəcə. [Zeynal] *arxadaşlarına nisbətən daha yüksək bir mövqedə olduğunu göstərmək üçün deyirdi.* S.Hüseyn. *Arada nə vəzifə, nə də mövqe fərqi görünürdü.* B.Bayramov.

3. Hərbi əməliyyat sahəsi, döyüş meydanı; cəbhə. *O gündən bir saat da olsun Nəriman mövqeyindən yayınmamışdı.* Mir Cəlal. □ **Mövqe tutmaq** – döyüş üçün müəyyən yerdə hazır durmaq. [İdrisin] *batalyonu azad etməyə can atdığı bir şəhərin qarşısındakı ataş xəttində mövqe tutmuşdu.* Ə.Məmmədxanlı. *İsmayıl kişi qocaman bir qoz ağacının altında, qaya dalında mövqe tutmuşdu.* P.Makulu.

4. Vəziyyət, hal. [Səlma:] *Aman, nə müşkül mövqedə qaldım, ah!* H.Cavid. [Molla Xəlil] *çıxılmaz bir mövqedə bulunurdu.* S.Hüseyn.

**MÖVQİF** *is.* [*ər.*] *köhn.* Duracaq yer, dayanacaq, stansiya. *Çaparların vəzifəsi dəmiryol mövqifindən gəlib şəhərə və şəhərdən gəlib mövqifə gedən poçtu müşayiət etmək idi.* Ə.Haqverdiyev. *Yevlax stansiyasında bir çox yolçu toplanmışdı, mövqifdə oturmaq deyil, durmağa belə yer yox idi.* T.Ş.Simurq.

**MÖVQUF** *sif.* [*ər.*] 1. *din.* Vəqf olunmuş, vəqf üçün ayrılmış (bax **vəqf**).

2. *klas.* Varlığı başqa bir şeyin varlığından asılı olan; asılı, bağlı, əlaqəli, əlaqədar. *Səltənətin davamı və silsilənin bəqası mövqufdur elmə.* M.F.Axundzadə. *Mövquf isə qəlbin fərəhi qətlimə, billah; Öldür məni, ey dilbəri-ziba, fərəh olsun!* S.Ə.Şirvani. □ **Mövquf olmaq** – asılı olmaq, bağlı olmaq, əlaqədar olmaq. [Nuxulular:] *Çox yaxşı, ağa, bu bir asan işdir, təki iksirin təkmili buna mövquf olsun.* M.F.Axundzadə.

3. Tərk etmə, unutma. □ **Mövquf etmək** – tərk etmək, unutmaq, bir işi daha etməmək. *İbrahim .. dükana getməyi mövquf edib oğlunun yanında qaldı.* Ə.Haqverdiyev. *Axır vaxtlar Kərbəlayı Fərəc bu yol ilə gedib-gəlməyi bilmərrə mövquf eləmişdi.* Çəmənzəminli. **Mövquf olmaq** – tərgidilmək, unudulmaq, daha edilməmək. *Etsin onları şiə gərək ildə ziyarət; Mövquf ola, heyhat, çətindir belə adət.* Ə.Qəmküsar.

**MÖVQUFAT** *is.* [*ər.* "mövquf" söz. cəmi] Vəqf edilmiş mal, mülk və s. *Bunların qışda odunu mövqufatdan verilir.* Ə.Haqverdiyev.

**MÖVLA** *is.* [*ər.*] *klas.* Allah, yaradan, tanrı. *Hər kimin ki mövla olur köməyi; Nə işi var sultan ilə, xan ilə.* M.V.Vidadi. *Xəstə könül gəzir bu təmənnada; Mərdlərin mövlası, sən yetiş dada!* Aşıq Ələsgər.

**MÖVLANA** *is.* [*ər.*] İslam şərqində bəzi görkəmli alim və şairlərə hörmət əlaməti olaraq verilən ad. [Əntiqfüruş:] *Aha, indi anladım, ey müsafir, haqlısan! Mövlana Füzulinin divanıdır bu divan!* B.Vahabzadə.

**MÖVLƏVİ** *sif.* [*ər.*] XIII əsrdə Türkiyədə Mövlana Cəlaləddin Rumi tərəfindən əsası qoyulmuş həmin adlı təriqətə mənsub adam (dərviş).

**MÖVLUD** *is.* [*ər.*] *klas.* Doğulmuş, anadan olmuş. ☐ **Mövlud bayramı** – Məhəmmədin anadan olma günü (müsəlmanların dini bayramı).

**MÖVSÜM** *is.* [*ər.*] 1. İlin dörd fəslindən hər biri; fəsil. *Payız mövsümü.* – *Qış mövsümü qayət soyuq, yağmurlu bir havada; Gördü ancaq arvad, uşaq qalmış kənddə, obada.* A.Səhhət. *Yaz mövsümü çəməndə; Yasəmənmi açılmış?* M.Seyidzadə.

2. İlin, hər hansı bir iş, məşğələ, istirahət və s. üçün istifadə olunan hissəsi; bir şeyin müəyyən vaxtı, zamanı. *İdman mövsümü. Teatr mövsümünün açılışı.* – *Yavaş-yavaş havalar soyuqlaşdıqca bağ mövsümü qurtarmağa başlardı.* H.Sarabski. *Dövlətlilərin çaydan o taydakı mal-qarasını, atını, heyvanını sudan bu taya keçirməklə* [çayqıraqlılar] *hər mövsümdə bir qədər qazanc əldə edirdilər*. Ə.Əbülhəsən. // Hər hansı meyvənin yetişdiyi, gülün açıldığı vaxt. *Üzüm mövsümü. Qızılgül mövsümü*. ☐ **Gül (çiçək) mövsümü** *şair.* – yaz, bahar. *Budur, gəldi gül mövsümü*. M.Müşfiq. *Çiçək mövsümündə bir axşam çağı; Yolum Qarabağdan Qazaxa düşdü.* H.Arif.

3. B a x **mövsümi** 2-ci mənada. *İnşaatçıların çoxu mövsüm işçilərindən: torpaqqazanlar, bənnalar və dülgərlərdən ibarət idi.* Ə.Sadıq.

**MÖVSÜMÇÜ** *is.* Mövsüm işlərində işləyən fəhlə, daimi deyil, mövsümlə işləyən işçi.

**MÖVSÜMÇÜLÜK** *is.* Daimi, müntəzəm deyil, mövsümdən-mövsümə aparılan iş üsulu. *Mövsümçülüklə mübarizə.*

**MÖVSÜMİ** *sif.* [*ər.*] 1. Müəyyən mövsümlə bağlı olan, mövsüm üçün olan. *Mövsümi palto*. – [Zahidoğlu] *bu gün öz nazik yay paltarından heç birini geyməli olmadı, mövsümi libaslarına yanaşdı*. S.Rəhimov. // Yalnız müəyyən mövsümə uyğun gələn, müəyyən vaxt üçün etibarlı olan. *Mövsümi qiymət. Mövsümi bilet*.

2. Müəyyən mövsüm ərzində görülən; daimi deyil, mövsümlə əlaqədar olan. *Mövsümi iş*.

**MÖVSÜMQABAĞI** *sif.* Mövsümün (2-ci mənada) yaxınlaşması ilə əlaqədar, bağlı. *Mövsümqabağı işlər.*

**MÖVSÜMLÜK** *sif.* Bir mövsüm üçün olan, mövsümlə əlaqədar olan. *Mövsümlük yığım norması.*

**MÖVT** *is.* [*ər.*] *klas.* Ölüm, vəfat. *Mövtünlə şad olurmu bu qəddar düşmənin; Ölsən də sən ürəklərimizdir nişimənin.* M.S.Ordubadi.

**MÖVÜC** *is.* Qurudulmuş üzüm. *Yaqub mövücdən götürüb, dəmlənmiş tünd çayı ləzzətlə içməyə başladı.* S.Vəliyev.

**MÖVÜCALAN** *is.* Üzüm, əncir və s. qurudulan yer. *Baba bağın bir guşəsində mövücalan qayırardı ki, külək şiddətli əsəndə sərgini külək aparmasın.* H.Sarabski.

**MÖVÜCÜ** *is.* Əsasən mövüc qurutmaq üçün işlədilən irigiləli üzüm növü. *Baba isə xatını, .. əsgəri, mövücü üzümləri dərib gətirər, tapdalayar və şirə yığardı*. H.Sarabski.

**MU** *is.* [*fars.*] *klas.* Saç, tük, tel. *Saçına uymuş xəyalım çünki ənbərbu kimi; Ol səbəbdən incəlib qəddim olubdur mu kimi.* M.P.Vaqif. *Yüz huri-qılman olaydı hazir; Mu qədri ülfət etməzdi xatir.* Q.Zakir.

**MUÁR** [*fr.*] 1. İşıq düşəndə müxtəlif rəngli çalarlar verən sıx toxunmuş ipək və ya yarımipək parça.

2. Səthində basma naxışları olan kağız.

**MUÁVR** *is.* [*xüs. is.*-dən] Triqonometrik şəkildə olan kompleks ədədi n-ci qüvvətə yüksəltmək üçün düstur.

**MUCUL** *is.* 1. Közərdilmiş dəmirin üst qabığı.

2. *dan.* Yanma, yanıb yığılma, büzüşmə. ☐ **Mucul olmaq** – mucullamaq. *Saçı mucul olmaq.* // Yanıq. *İşıqla bərabər ortalığa tüstü və bərk mucul iyi yayılmağa başladı.* Ə.Əbülhəsən.

**MUCULLANMA** "Mucullanmaq"dan *f.is.*

**MUCULLANMAQ** *f.* Yanıb yığılmaq; büzüşmək, yığılmaq. *Yun yanıb mucullandı.*

**MÚFEL** *is.* [*alm.*] Sənayedə işlədilən elektrik və ya alovlu qızdırıcı soba.

**MUFLÓN** *is.* [*fr.*] Qoyun növü; dağ qoyunu.

**MUFTA** [*alm.*] 1. *tex.* Val, boru və s. kimi silindrik şeyləri bir-birinə rəbt etmək üçün metal halqa, bilərzik.

2. Əlləri soyuqdan qorumaq üçün xəzdən və s.-dən hər iki tərəfi açıq isti kisəcik. [Mariya] *kürkünü çıxartmayıb, əllərini muftaya soxub oturmuşdu.* Çexovdan.

**MUĞ** *is.* [*fars.*] *tar.* Zərdüşt dininə mənsub adam; atəşpərəst, məcusi.

**MUĞAM** *is.* [*ər.* məqam – mövqe] *mus.* 1. Bir neçə hissədən ibarət vokal-instrumental və ya instrumental Şərq musiqisi. *Segah muğamı. Humayun muğamı. – XIX əsrin ikinci yarısında Hacı Hüsü, Məşədi İsi kimi məşhur xanəndələr segah muğamını xüsusi məharətlə ifa edirdilər.* Ə.Bədəlbəyli. *Qızlar radio müsamirələrini, oyun havalarını, Azərbaycan muğamlarını eşitdikdə bütün əziyyətləri unudur*(*lar*). Ə.Vəliyev.

2. Bax **lad**. *Azərbaycan xalq musiqisi praktikasında yeddi əsas lad yaxud muğam* (*rast, şur, segah, şüştər, çahargah, bayatı-şiraz və humayun*) *və əlavə daha bir çox başqa muğamlar tətbiq olunur.* Q.Qarayev.

**MUĞAMAT** [*ər.* "məqam" söz. cəmi] Muğam tərzində olan havalar. *Muğamat çalmaq. – Xanəndə muğamat ilə bəyi təbrik edən aşarı oxuyur.* R.Əfəndiyev. *Məlumdur ki, tar müşayiəti ilə oxunan muğamat parçaları inqilabdan qabaq yazılmış Azərbaycan operalarında musiqinin əsas hissəsini təşkil edir.* Ə.Bədəlbəyli.

**MUĞAMATÇI** 1. *is.* Əsasən muğam oxuyan xanəndə.

2. Bax **muğamatşünas**.

**MUĞAMATŞÜNAS** *is.* [*ər.* məqamat və *fars.* ...şünas] Muğamatları yaxşı bilən musiqişünas. *O vaxt Şirvanda Mahmud ağa adında bir muğamatşünas var idi.* Ə.Haqverdiyev.

**MUĞAMVARİ** *sif.* Muğama oxşayan, muğam tərzində olan. *Muğamvari melodiya.*

**MUĞAYAT** [*ər.* müqəyyəd]: **muğayat olmaq** – qorumaq, gözü üstündə olmaq, zərər toxunmağa qoymamaq, göz olmaq. *Uşaqdan muğayat ol. Özündən muğayat olmaq.* – [Mirzə Fərəc:] *Qafar, sən bunlardan muğayat ol.* S.S.Axundov. [Rizvan:] *Qapı-bacanı möhkəm bağla, .. heyvanlardan muğayat ol!* S.Hüseyn.

**MUXRU** *is. məh.* Böyük uzun alaçıq. *Comərd dəstəni lap kənardakı tək muxruya tərəf çəkdi.* Ə.Abasov.

**MUXTAR** *sif.* [*ər.*] 1. Muxtariyyət hüququ olan. *Muxtar vilayət. Muxtar respublika. Dağlıq Qarabağ Muxtar Vilayəti.*

2. *klas.* Sərbəst, müstəqil, azad, asılı olmayan, ixtiyarı özündə. *..Bizlərdə övrəti boşamaq lazım olanda həmişə meydana bir bəhanə gəlir, vəhalonki kişi övrəti boşamaqda muxtardır.* C.Məmmədquluzadə. *Buna kim yol verəcəkdir ki, qız olsun muxtar; Kişilər eyləsin insan kimi qızla rəftar?* C.Cabbarlı.

**MUXTARİYYƏT** *is.* [*ər.*] Daxili qanunvericilik və idarəetmə işlərində sərbəst olma hüququ; özünüidarə. *Muxtariyyət tələb etmək.*

**MUXTARİYYƏTLİ** bax **muxtar** 1-ci mənada.

**MUXUL** *sif. məh.* İşə can yandırmayan, səhlənkar.

**MUJÍK** [*rus.*] *köhn.* 1. Kəndli. [Heydər bəy:] *Naçalnik, hər belə mujik sözünə etibar edib məni bədbəxt etməyin!* M.F.Axundzadə.

2. Burjua-zadəgan dilində: savadsız, cahil, tərbiyəsiz, kobud adam haqqında.

**MUKÁLTİN** *is.* [*lat.*] Bəlğəmgətirici dərman preparatı.

**MUKÓR** *is.* İbtidai göbələklər sırası.

**MULÁT** [*isp.* mulato] Avropalılarla zəncilərin nikahından əmələ gələn.

**MÚLDA** *is.* [*alm.*] 1. Tökmə maşında çuqun almaq üçün metal qəlib.

2. Xammal üçün metal qutu.

**MULİNÉ** [*fr.* moulinet] Tikmədə işlədilən müxtəlif rəngli sap növü.

**MULTİPLİKÁSİYA** [*lat.* multiplicatio – çoxaltma] Hərəkətin ayrı-ayrı momentlərini təsvir edən şəkil və ya kuklaların kinoya çəkilməsi, habelə bu cür çəkilmiş şəkillərdən ibarət kinofilm. *Multiplikasiya filmi.*

**MULTİPLİKASİYAÇI** bax **multiplikator**.

**MULTİPLİKÁTOR** [*lat.*] Multiplikasiya mütəxəssisi; multiplikasiyaçı.

**MUM** *is.* [*fars.*] 1. Bal arılarının hazırladığı və şan düzəltmək üçün istifadə etdikləri maddə, habelə ona oxşar bitki maddəsi. *Arı mumu. Bitki mumu.* – [Mirzə Heydər:] *Heç*

*bir az mum olarmı səndə?* Ə.Haqverdiyev. □ **Mum kimi** – 1) qatı; bərk olmayan, yumşaq. *Usta baxdı ki, doğrudan da bu daş mum kimi bir şeydir*. "Koroğlu". *Uşağın bədəni mum kimi bir şeydir*. N.Vəzirov; 2) *məc.* asan, tez başa gələn, az zəhmət tələb edən. *Mədəd indi anlayırdı ki, mübarizə mum kimi yumşaq olmağı demir.* S.Rəhimov.

2. *köhn.* Şam. *Mum yandırmaq*. – *Gecənin üç payı keçmiş, mumlar, çıraqlar sönmüş, təbiəti matəməngiz bir zülmət bürümüşdü.* A.Şaiq.

◊ **Mum gün üçün** – dar gün üçün, ağır gün üçün. *Mum gün üçün saxlamaq.* **Mum kimi ərimək (sönmək)** – b a x **muma dönmək** 2-ci mənada. *Hər gecə mum tək əridim, yandım odlara*. S.Ə.Şirvani. *Layiqmi, o bir mum kimi sönsün; Heçdən silinən kölgəyə dönsün?* H.Cavid. *Cavan ömrüm bir mum kimi sönərkən; Çıxıb verdim şimşəklərə könlümü.* M.Müşfiq. **Mum olmaq** – b a x **muma dönmək** 1-ci mənada. *Dərd əlindən solmuşam; Saç-birçəyim yolmuşam; Axır bu eşq yolunda; Əriyib mum olmuşam.* (Bayatı). **Muma dönmək** – 1) bəzən "yumşalıb" feli ilə – ram olmaq, yumşalmaq. [Camal:] *Çəkərəm* [Yusifi] *yuxarıya, yumşalıb muma dönər*. S.Rəhman. [Zərnişan Səlimə:] *Elə isə Əlikramın üç şirin kəlməsi ilə niyə belə muma döndün, andını-amanını unudub* [Əlikrama] *təzədən qardaş oldun?* B.Bayramov; 2) çox vaxt "saralıb" feli ilə – saralmaq, zəifləmək, üzülmək, candan düşmək, çox arıqlamaq. *Karvansaraçı gördü, balam, bu dostu günü-gündən saralıb muma dönür*. (Nağıl). *Fikir və xəyalatdan* [Mahmud] *saralıb muma dönmüşdü*. B.Talıblı.

**MUMGÜVƏSİ** *is. zool.* Əsasən arı pətəklərində yaşayan zərərverici.

**MUMİYA**[1] *is.* [*ər.*] 1. Balzamlanma vasitəsilə çürüməkdən qorunmuş insan cəsədi. *Bir çox Misir mumiyası hal-hazıra qədər qalır və muzeylərdə saxlanılır.* "Qədim dünya tarixi".

2. *məc.* Dərman, dava, əlac. *Bir sınmışa mumiya dilərdim; Bir xəstə üçün şəfa dilərdim*. Füzuli.

3. *məc.* Cansızlığı, arıqlığı, hərəkətsizliyi və s. xassələri ilə qurumuş cəsədi xatırladan adam haqqında. *Yazıq Xədicə dizlərini qucaqlayıb bir küncdə mumiya kimi oturmuşdu.* S.S.Axundov.

**MUMİYA**[2] *is.* [*ər.*] Müxtəlif qırmızı rəngləri olan toz halında mineral boya.

**MUMİYALAMA** "Mumiyalamaq"dan *f.is.*

**MUMİYALAMAQ** b a x **balzamlamaq**.

**MUMİYALANMA** "Mumiyalanmaq"dan *f.is.*

**MUMİYALANMAQ** b a x **balzamlanmaq**.

**MUMLAMA** "Mumlamaq"dan *f.is.*

**MUMLAMAQ** *f.* 1. Mum sürtmək, mum çəkmək. *Eşilmiş sapı mumlamaq*.

2. Bir şeyin (qabın, şüşənin və s.-nin) ağzını mumla bağlamaq, qapamaq. *Qabın ağzını mumlamaq*.

3. *məc.* Susmaq, danışmamaq, ağzını açmamaq, dinməmək. *Nə olub, belə mumlamısan?*

**MUMLANMA** "Mumlanmaq"dan *f.is.*

**MUMLANMAQ** *məch.* 1. Mum sürtülmək, mum çəkilmək. *Viş mumlanıb.*

2. Mumla bağlanmaq, qapanmaq. *Bankanın ağzı mumlandı*.

**MUMLU** *sif.* Mum sürtülmüş, mum çəkilmiş. *Mumlu ip.*

**MUNCUQ** *is.* Müxtəlif rəngli, yuvarlaq və ya başqa formalı şüşələrdən, plastik kütlədən və s.-dən qayrılıb sapa düzülən və bəzək kimi boyuna taxılan dənələrdən hər biri, habelə bu bəzəyin özü. *Muncuğu sapa düzmək. Boynuna muncuq taxmaq*. – *Qonşu muncuğunu götürən gərək gorda taxsın.* (Ata. sözü). *Boynundan bir çox kiçik və iri muncuqlar asmış bir dərviş .. əlində kəşkül və təbərzin oxuya-oxuya gedir.* A.Şaiq. [Bülənd] *..Nazlının boynundakı kəhrəbaların və muncuqların hamısını dartıb qopartdı.* Ə.Əbülhəsən. □ **Muncuq kimi** – bir biçimdə, bir boyda (adətən yumru şəkildə) olan şeylər haqqında. *Üzündən muncuq kimi tər axır.* // Müntəzəm sıra halında düzülmüş şeylər haqqında. *Reyhan xanım daxil oldu, Rüxsarə xanımı görüncə muncuq kimi düzülmüş ağ dişləri göründü*. T.Ş.Simurq.

**muncuq-muncuq** *sif.* və *zərf* Gilə-gilə, dənə-dənə, yumru-yumru, muncuq kimi (axan tər haqqında). *Muncuq-muncuq tər tökmək.* – *Bir az sonra görürəm bir ucaboylu oğlan; Yaxınlaşır, üzündən muncuq-muncuq axır tər.* S.Rüstəm.

**MUNCUQGÖZ** *sif.* Gözü muncuğa oxşayan, muncuğa bənzəyən, muncuq kimi; muncuqvari gözü olan. [Hacı] *sizin bildiyiniz qarğaburun, muncuqgöz, təkəsaqqal hacılara bənzəməz*. Qantəmir.

**MUNCUQLANMA** “Muncuqlanmaq”dan *f.is.*

**MUNCUQLANMAQ** *f.* Muncuq-muncuq olmaq, muncuq kimi düzülmək, muncuq şəklinə düşmək, yumrulanmaq. [Şiraslanın] *..həyəcandan alnında tər dənələri muncuqlanırdı.* S.Rəhimov. *Mahmud üzündə muncuqlanan utancaqlıq tərini yaylıqla silib sözə başladı*. P.Makulu.

**MUNCUQLU** *sif.* Üzərinə muncuq tikilmiş, yaxud muncuq düzülmüş, muncuqla bəzədilmiş. *Muncuqlu tikmə.*

**MUNCUQVARİ** *sif.* Muncuğaoxşar, muncuq kimi, muncuq-muncuq.

**MÚNDA** *is.* 1. Hindistanda ən qədim dil qruplarından biri.

2. Hindistan xalq qruplarından biri.

**MUNDİR** [*fr.* monture] Hərbi və ya mülki rəsmi geyim. *Mundir geymək. Zabit mundiri.* – *Oğlan mundirinin düymələrini bağladı.* İ.Əfəndiyev.

**MUNDİRLİ** *sif.* Mundir geyinmiş, əynində mundir olan. *Mundirli general.*

**MUNİS** [*ər.*] 1. *sif.* Hər kəslə mehriban olan; ünsiyyətli, mehriban; istiqanlı. *Munis adam.* – [Xədicə] *olduqca xoşsöhbət, .. genişqəlbli, munis və mehriban bir qız idi.* S.Hüseyn. *Könüllər yolçusu, o munis gözəl; Min ürək fəth edir hər keçən anda.* S.Vurğun.

2. *is.* Yaxın adam, mehriban dost, sirdaş, ürək dostu. *Dilbərim, yarım, əzizim, qəmküsarım, munisim; Can şikarım, sevgili yarım canımın cananıdır.* Xətayi. [Pəri xanım:] *Kimə dərdimi söyləyim? Yoldaş yox, munis yox, həmdəm yox.* Ə.Haqverdiyev. ◻ **Munis olmaq** – ürək dostu olmaq, ən yaxın yoldaş, sirdaş yerini tutmaq, mehriban olmaq. *Qalmışam vadiyi-qəm içrə, kimim var, Zakir; Didələr oldu həmin munisü qəmxar mənə.* Q.Zakir. *Bu gün gülən yarın ağlar, saqın, öyünmə, düşün! Düşün də, munis ol! İncitmə, qırma kimsəni sən!..* H.Cavid. // Sevgili, istəkli, məhbubə. [Rəhim:] *..Ağa, Allah xatirinə mənim munisimi əlimdən alma.* N.Vəzirov. *Deyəsən, Vahid* [Rübabənin] *həmişəlik və əvəzsiz munisi olmuşdur*. Mir Cəlal.

3. *sif. məc.* Xoş, fərəhverici, ürəyəyatan, ruhu oxşayan. *Munis gecə. Munis mənzərə.* – *..Baharın həyatverici munis günəşi dağların arxasında gizləndiyindən ətrafa həzin bir axşam qaranlığı sinməkdə idi*. S.Hüseyn. [Nuriyyə:] *Bu geniş çöllər, bu nəhayətsiz sükut, bu munis aydınlıq onda da var idi, indi də var.* İ.Əfəndiyev.

**MUNİSLİK** *is.* Munis olma; istiqanlılıq, mehribanlıq, səmimilik.

**MÚNQU** *is.* Monqolustanda nikel və bürünc xırda pul.

**MURAD** *is.* [*ər.*] Arzu, məqsəd, niyyət, dilək, istək, kam. *Sən muradım əksinə, ey çərx, rəftar eylədin*. S.Ə.Şirvani. *Aşıq Ələsgərəm, söylənir adım; Budur ürəyimdə mətləb, muradım*. Aşıq Ələsgər. *Ürək dəmir deyil, daş da deyil ki? Min bir muradı var, min bir arzusu!* S.Vurğun. ◻ **Murada (muradına) irmək** – bax **murada çatmaq**. *Kaş ki, Kərəm muradına ireydi; Qismət olub yarın üzün göreydi.* “Əsli və Kərəm”. *Bir gülən yox bu qayğılı dünyadə; Çoxlar nakam olub irməz murada*. H.Cavid. **Murada (muradına) yetirmək** – arzusuna çatdırmaq, istəyini yerinə yetirmək. *Bivəfa dünyada, dəhrifənada; Fələk məni yetirmədi murada*. M.V.Vidadi. *Muradım ol məhəlində şəhid olmaqdır; Nolur yetirsə fələk rəhm edib muradə məni.* S.Ə.Şirvani. [Süleyman:] *Əcəb elərsən, Allah səni də tez muradına yetirsin, bizi də..* Ü.Hacıbəyov. **Murada (muradına) yetmək (çatlaq)** – arzusu hasil olmaq, məqsədinə, diləyinə, kamına çatmaq. *Saldıqca cavanlıqda keçən günləri yadə; Dərdim olur on qat; Yarəb yetərəm birdəmi dünyadə muradə?* M.Ə.Sabir. *Hacı Qara nəinki muradına çatmadı, hətta həbsə düşdü*. N.Nərimanov. **Muradı hasil olmaq** – bax **murada (muradına) yetmək (çatmaq**). [Bəlli Əhməd:] *Koroğlunun dəlilərdi imdadı; Qılınc çəkdi, hasil ola muradı.* “Koroğlu”. **Muradını vermək** – muradına, arzusuna çatdırmaq, istəyini yerinə yetirmək. *Bu Xətayi xəstənin vergil muradın, ya ilah!* Xətayi. *Mən Zakirəm, pir fələkə neylədim; Vermədi muradım, dedim, söylədim*. Q.Zakir.

**MURADÇİÇƏKLİLƏR** *cəm, bot*. Sərbəstləçəkli tacı olan, çiçəklərinin hissələri dörd dairə üzrə düzülən bitki fəsiləsi.

**MURDAR** *sif.* [*fars.*] 1. Müsəlman dini etiqadınca təmiz sayılmayan; napak (*pak* əksi). *Murdar su*. – [Pişik itə:] *Bil nə səbəbdən belə murdarsan; İstəməzsən xeyr apara hiç kəs*. S.Ə.Şirvani. ◻ **Murdar etmək (eləmək)** – 1) müsəlman dini etiqadınca pak sayılan şeyi murdar sayılan şeyə toxundurub, sürtüb və ya vurub onu da napak etmək. *Əlini itə vurub murdar eləmək*. – [Arvad:] *A kişi, a kişi, başuva daş, içəri girmə, üst-başın murdardır, aləmi murdar elərsən*. H.Sarabski; 2) *məc. dan.* öldürmək, gəbərtmək. *İnəyi murdar etmək*. **Murdar olmaq** – 1) müsəlman dini etiqadınca murdar sayılan şeyə toxunub, dəyib natəmiz, napak olmaq; 2) *məc. dan.* ölmək, gəbərmək (heyvan haqqında). *Toyuq murdar oldu*. – [Mirzə İsmayıl:] *Necə, yoxsa xanın qəzəbindən xəbəri yoxdur? Bilmirmi ki, o qədər vurarlar, qamçı altında canı çıxıb, it kimi murdar olar?* Ə.Haqverdiyev; // eyni mənada adam haqqında həqarətlə deyilir. *Əsəd o saat murdar oldu*. "Qaçaq Nəbi". *Göstərmə təbibə o cigərguşəni, zinhar; Qoyma ola murdar*. M.Ə.Sabir. [Əzim dayı:] *Tüfəngin qundağı ilə nə qədər vurdumsa tərpənmədi, bu da murdar olmuşdu*. A.Şaiq.

2. Ümumiyyətlə, pis, alçaq, iyrənc, ikrah doğuran, xoşa gəlməyən. *Murdar təbiətli adam. Murdar iş*. – [Qurban:] *Mənim bu murdar ürəyimi çəkib itlərə tullayın*. Ə.Haqverdiyev. [Maral:] *Burada qalsam Turxan bəyin murdar nəfəsi, qoşulub qaçarsam namus, iffət məsələsi!* H.Cavid. // İs. mənasında. *Mən dünyada çox bihəya adamlar görmüşəm, amma bunun kimi murdarına hələ rast gəlməmişəm*. N.Vəzirov.

3. *məc.* Zəhlətökən, xoşagəlməyən, pis. *Bayırda murdar hava var*. – [Firidun bəy:] *Ah, bu murdar səsləri susduracaq birinci top atəşi, başlamazmısan?* H.Nəzərli. [Rza:] *Həmzə adını eşidən kimi mənim xəyalımda ağır, anlaşılmaz, murdar bir aləm açıldı*. M.İbrahimov.

**MURDARÇA** *is. bot.* Ağ rəngli çiçəkləri olan, meyvəsi yeyilməyən, qabığında aşı maddəsi olan ağac və ya kol. *Cır zoğal və ya qara murdarça 3-4 metr hündürlükdə, qışda yarpağı tökülən ağac və ya koldur. Ağ rəngli çiçəkləri mayda açılır, qara rəngli çəyirdəkli meyvəsi xırdadır, avqustda yetişir, yeyilmir*. H.Qədirov.

**MURDARÇAÇİÇƏKLİLƏR** *cəm, bot.* Sərbəst ləçəkli tacı olan, çiçəklərinin hissələri dörd dairə üzrə düzülən bitki fəsiləsi.

**MURDARÇILIQ** b a x **murdarlıq**.

**MURDARLAMA** "Murdarlamaq"dan *f.is.*

**MURDARLAMAQ** *f.* 1. Murdar (1-ci mənada) etmək, napak etmək.

2. *məc. dan.* Gəbərtmək, öldürmək. *Eyvaz kişi dərindən köksünü ötürüb dedi: – Uşaqlar! Canınız üçün, kafir az qala məni murdarlamışdı*. Ə.Vəliyev.

**MURDARLANMA** "Murdarlanmaq"dan *f.is.*

**MURDARLANMAQ** *məch.* Murdar (1-ci mənada) olmaq, napak olmaq.

**MURDARLIQ** *is.* 1. Murdar (1-ci mənada) olma, pak, təmiz olmama; napaklıq. *Su murdarlıq götürməz*. (Ata. sözü).

2. *məc.* Pislik, alçaqlıq, rəzillik. *Murdarlıq adını üstümüzdən götürmək üçün uzun və qanlı mübarizə lazımdır*. M.S.Ordubadi.

**MURQUZ** *is. bot.* Taxıllar fəsiləsindən qarğıyabənzər bitki.

**MURMURDAR** b a x **murdar**. *Əl-ayağı murmurdardır. – Ölülərini niyə dəxi hər yerdən tabutlar içində atlara, eşşəklərə, qatırlara mindirib Kərbəlaya, Nəcəfə daşıyırsan, ölkəni və yolları və mənzilləri .. cəmdəklərin iyindən murmurdar edirsən*. M.F.Axundzadə.

**MUROV** *is. tar.* Keçmiş zamanlarda kənd yerlərində polis vəzifəsini ifa edən hökumət məmuru. *Murovlar olublar oğruya ortaq*. Q.Zakir. *Murovlar, pristavlar, naçalniklər, hətta qubernatorun özü* [Əbdülkərimin] *əlində aciz qalıb, öhdəsindən gələ bilmirdilər*. Ə.Haqverdiyev.

**MUROVLUQ** *is. tar.* Murov vəzifəsi, murov rütbəsi. *Murovluq eləmək*. // Murovlar olduğu dövr. [Səlim bəy:] *Hanı keçən günlər? Hanı murovluq zamanı?* Ə.Haqverdiyev.

**MUSİQAR** *is.* 1. Guya dimdiyində çoxlu deşiklər olub, külək əsdikcə müxtəlif səslər çıxaran əfsanəvi bir quş.

2. *köhn.* Bir sıra düdüklərdən ibarət musiqi aləti. *Nalə ilə sızlaram hərgah musiqartək.* Qövsi. *Doğma xalqın musiqisini və çalğı alətlərini yaxşı bilən şair .. musiqar, ud və qopuz .. kimi musiqi alətlərini yüksək bədii dillə təsvir edir.* "İncəsənət".

3. *köhn.* Musiqiçi. *Ümumi musiqi sənəti bizim də aramızda intişar taparsa, o halda biz mədəniyyətin hər bir qismində iştirak etmiş olarıq; .. ümumi musiqi sənətini dəxi öyrənərsək, alim musiqişünaslarımız, musiqarlarımız, orkestrlərimiz və opera artistlərimiz də olmaqla, mədəniyyətin sənayei-nəfisə qismində dəxi iştirak etmiş oluruq.* Ü.Hacıbəyov.

**MUSİQİ** *is.* [*ər.* əsli *yunancadan*] 1. İnsanın təəssüratını, hiss və ideyalarını ritm və intonasiya cəhətdən mütəşəkkil səslərlə ifadə edən sənət. *Xalq musiqisi. Şərq musiqisi. Klassik musiqi. – Bir qədər keçəndən sonra musiqiyə olan həvəsim o qədər azaldı ki, başıbəlalı düdüyü bilmərrə gözdən saldım.* C.Məmmədquluzadə. // Bu sənətə aid əsər və ya əsərlər. *Ü.Hacıbəyovun musiqisi. M.Maqomayevin musiqisi.*

2. Həmin sənətin, vokaldan fərqli olan instrumental (çalğı alətləri ilə ifa edilən) növü. *Cəfər Cabbarlının "Sevil" əsərinə yazılmış musiqi. – Pərdədən qabaq musiqi çalınır.* Ü.Hacıbəyov. *Dünyanı öz səsi və öz musiqisi ilə titrədən böyük sənətkarın əlləri titrəyirdi.* M.S.Ordubadi.

3. Musiqi əsərlərinin ifası; çalğı. *Musiqiyə qulaq asmaq. Musiqidən zövq almaq. Musiqi səsi. – Başla musiqiylə bizim bayramı; Əlində yaylığı oynasın hamı.* S.Vurğun. *Birdən şirin bir musiqi axıb gəldi.* İ.Əfəndiyev.

4. *məc.* Musiqini xatırladan, qulağa xoş gələn, ahəngdar, melodik səs. [Qızın] *səsi həzin bir musiqi qədər xoş idi.* S.Hüseyn.

5. Musiqiyə aid olan, musiqi ilə bağlı olan. *Musiqi məktəbi. Musiqi gecəsi. Musiqi alətləri. – Şənləndirir hər kəsi; Bir musiqi məclisi.* A.Şaiq. [Rəhim:] *Mən müharibədən əvvəl Bakıda dövlət konservatoriyası yanında onillik musiqi məktəbində oxuyurdum.* Ə.Sadıq.

**MUSİQİBAZ** *is.* [*ər.* musiqi və *fars.* ...baz] bax **musiqipərəst**. [Qulu:] [Sədr] *yaman musiqibazdır.* İ.Əfəndiyev.

**MUSİQİÇİ** *is.* 1. Xüsusi olaraq musiqi ilə məşğul olan adam, musiqi mütəxəssisi.

2. Musiqi alətində çalan sənətkar; çalğıçı, çalan. *Festivalda musiqiçilər də çıxış etdilər. – Musiqiçilər gəldi, hərə bir dəstə çiçək hazırladı.* Çəmənzəminli. [Məzlum] *indi* [restoranda] *yeganə musiqiçidir.* S.Vəliyev.

**MUSİQİÇİLİK** *is.* 1. Xüsusi olaraq musiqi ilə məşğul olma; musiqi mütəxəssisinin sənəti.

2. Çalğıçılıq.

**MUSİQİLİ** *sif.* Musiqi ilə olan, musiqi ilə birlikdə icra olunan, musiqi ilə müşayiət edilən. *Musiqili-ədəbi montaj.* ☐ **Musiqili komediya** – musiqi ilə müşayiət olunan komediya; operetta. *Üzeyir bəy Hacıbəyovun musiqili komediyaları.*

**MUSİQİLİK** *is.* Musiqi ahəngi, xoş ahəng; məlahət, ahəngdarlıq, ahəng, gözəllik (səsdə). *Böyük şair Nizaminin şeriyyətində olan musiqilik kompozitorlarımıza Nizami mövzuları yaradıcılığında geniş imkanlar yaratmışdır.* Ə.Bədəlbəyli.

**MUSİQİPƏRƏST** *sif.* [*ər.* musiqi və *fars.* ...pərəst] Musiqini çox sevən, musiqiyə məhəbbəti olan, musiqi həvəskarı, musiqi pərəstişkarı. *Reyhan musiqipərəst olduğunu boynuna alır.* Mir Cəlal.

**MUSİQİPƏRƏSTLİK** *is.* Musiqi həvəskarı olma, musiqiyə məftunluq, musiqini sevmə, musiqi pərəstişkarlığı.

**MUSİQİŞÜNAS** *is.* [*ər.* musiqi və *fars.* ...şünas] Musiqişünaslıq mütəxəssisi. *Musiqişünasların dediyinə görə, xəstəlikdən qalxandan bəri Həsən öz sənətində irəliləyərək daha da böyük məharət göstərməyə başlamışdı.* B.Talıblı. *Hüseynqulunun bəxtini bir şey açdı ki, məşhur musiqişünas Üzeyir Hacıbəyov "Leyli və Məcnun" adında bir opera yazdı.* S.Rəhman.

**MUSİQİŞÜNASLIQ** *is.* Musiqi tarixi və nəzəriyyəsini, xalqların musiqi mədəniyyətini öyrənən elm.

**MUSKÁT** [*fr.* muskat] 1. Xoşiyli üzüm növü. *Ağ muskat.*

2. Bu üzümdən hazırlanan şərab növü.

**MUSLÍN** [*fr.* mousseline] Yüngül, yumşaq və nazik parça. *İpək muslin. Yun muslin.*

**MUSSÓN** [*fr.* mousson, əsli *ər.* mövsüm] Qışda qurudan dənizə, yayda dənizdən quruya doğru vaxtaşırı əsməklə istiqamətini dəyişən külək.

**MUSTÁNQ** *is.* [*isp.*] Vəhşiləşmiş ev atı.

**MUŞHAMUŞ** b a x **mışamış**. ..*Bədbəxt Şəfiqə əziz balalarının yanına gedib, onları muşhamuş yuxulamış görüb, onlara busə göndərib öz yataq otağına getdi.* İ.Musabəyov.

**MUŞKÉT** *is.* [*isp.*] İriçaplı, fitilli tüfəng. *Muşket sonralar çaxmaqdaşılı tüfənglə əvəz edildi.*

**MUŞKETYÓR** *is.* [*isp.*] XVI əsrin əvvəlindən Avropa ordularında piyada növü. *Kral muşketyorları.*

**MUŞQURMA** "Muşqurmaq"dan *f.is.*

**MUŞQURMAQ** *f.* Minik və qoşqu heyvanlarını hərəkətə gətirmək, it və s. heyvanları yaxına çağırmaq üçün dodaqları büzərək muşquruq səsi çıxarmaq. *Muşqurub iti çağırmaq.* – *Məmməd nə qədər muşqurdusa, eşşək yerindən tərpənmədi.* E.Sultanov. *Məcid, xanımın məzəmmətini eşitcək atı muşqurub sürdü.* B.Talıblı.

**MUŞQURTU, MUŞQURUQ** *təql.* Muşqurmaqdan hasil olan səs.

**MUŞTULUQ** *is.* 1. Xeyir xəbər, şad xəbər, xoş xəbər, sevindirici söz; müjdə. *Bəndalının səsi həyətdə böyük nicat xəbəri, bir muştuluq kimi səsləndi.* Mir Cəlal. ◻ **Muştuluğa getmək** – xeyir xəbər aparmaq, şad xəbər vermək üçün getmək. [Xanmurad:] *Muştuluğa gedirəm.* İ.Əfəndiyev.

2. Xeyir (şad) xəbər gətirənə verilən şey, bəxşiş. ..*Bu hamıya məlumdur ki, birinin oğlu olanda xəbər gətirib muştuluq alırlar.* C.Məmmədquluzadə. *Bilirsən ki, anandan muştuluq alım deyə; Mən özüm gedəcəyəm birbaş sizin şenliyə.* Ə.Cəmil. [Dərzi:] *Padşah, muştuluğumu ver, balaca oğlun Məlikməmmədin yerini deyim.* Çəmənzəminli.

◊ **Muştuluğun borc olsun!** – verilən xəbəri istehza ilə qarşıladıqda işlədilən ifadə.

**MUŞTULUQÇU** *is.* Xeyir xəbər, muştuluq xəbəri gətirən adam; müjdəçi. *Ay ötüb, il dolandı, bir gün evə muştuluqçu gəldi.* S.Rəhimov. *İydələr gül açanda Şahbikə bir oğlan doğdu, Qafar kişiyə muştuluqçu getdi.* M.Arif.

**MUŞTULUQLAMA** "Muştuluqlamaq"dan *f.is.*

**MUŞTULUQLAMAQ** *f.* Xoş xəbər vermək, şad xəbər yetirmək, müjdə vermək. [Məlikməmməd dərziyə:] *Dur get, padşahı muştuluqla ki, balaca oğlunu tapmışam.* (Nağıl). [Nəcəf:] *Kimi muştuluqlamağa gedirsən?* İ.Əfəndiyev.

**MUŞTUT** *is.* Cır tut. // Xartut növü.

**MUTAGEN** *is.* [*lat.* muto – dəyişirəm və *yun.*] İrsi dəyişikliklər yaradan fiziki və kimyəvi amillər. *Fiziki mutagenlər. İonlaşdırıcı şüaların bütün növləri mutagendir.*

**MUTANT** *is.* [*lat.*] Dəyişiklik nəticəsində yaranıb normal tipdən irsiyyətə görə fərqlənən forması.

**MUTÓN** *is.* [*lat.*] Genin ən kiçik hissəsi.

**MUY** b a x **mu**. *Tənha oluram orada üryan; Muyi-sərim eylərəm pərişan.* Füzuli. *Qəm evində saldın küncə Vaqifi; Eylədin muyindən incə Vaqifi.* M.P.Vaqif.

**MUYƏ** *is.* [*fars.*] *mus*. Bir neçə muğam dəsgahının şöbələri arasında guşə.

**MUYMUL** *is. zool.* Sərçəkimilər fəsiləsindən quş.

**MUZ** b a x **mız**. *Qaçağan dana muzunu bərkidər.* (Ata. sözü).

**MUZD** *is.* [*fars.*] 1. Görülən iş müqabilində verilən əmək haqqı; zəhmət haqqı; haqq. *Fəhləyə muzd vermək.* – [Allahqulu:] *Gündəlik muzdumuz çox az idi.* S.S.Axundov. [Firuz] .. *balaca nəvəsinin muzdu ilə qazanılmış bir parça çörəyə möhtacdır.* Ə.Məmmədxanlı. // Görülən işin pulla dəyəri, haqqı. *İşin muzdu nə olacaq?*

2. *məc.* Qarşılıq, mükafat. [Koroğlu:] *Mənim də atam ömrünü, gününü Həsən xanın qapısında çürütmüşdü, axırda muzdu o oldu ki, xan gözlərini çıxartdırdı.* "Koroğlu". [Soltan bəy Əsgərə:] *Sənin muzdun bu olar ki, mənim kimi bəylə qohum olarsan.* Ü.Hacıbəyov.

**MUZDLU** *sif.* 1. Muzdla işləyən, muzdla işləyib zəhmət haqqı alan, hər hansı bir işi haqla yerinə yetirən. *Muzdlu fəhlə. Muzdlu işçi.*

2. Muzdla görülən, əmək haqqı ilə yerinə yetirilən. *Muzdlu iş. Muzdlu əmək.*

**MUZDSUZ** *sif.* və *zərf* Əmək haqqı verilməyən; pulsuz, havayı. *Muzdsuz iş. Muzdsuz işləmək.* – [Polad] *dayısı Nuruşun yanında muzdsuz, maaşsız işləyib buruq işlərində təcrübə sahibi olmağa can atdı.* A.Şaiq.

**MUZDUR** *is.* [*fars.*] *köhn.* Mülkədar və ya qolçomaq təsərrüfatında muzdla işləyən kənd təsərrüfat fəhləsi. [Hacı Qambay] *muzdur işlətmək əlverişli olmadığına görə kənd təsərrüfatında qadın zəhmətindən az-çox istifadə edirdi*. Qantəmir. [Müəllim] *keçmişdə yeri-yurdu olmayan, haman bu kənddə onun-bunun bağında, bostanında, tarlasında işləyən bir muzdurun oğlu idi*. M.Rzaquluzadə. // Ümumiyyətlə, fəhlə. *Mürsəqulu .. Hacı Aslanın paroxodunda muzdur idi*. S.Hüseyn.

**MUZDURÇULUQ** *dan.* b a x **muzdurluq**. *Ayın çox vaxtını* [Alı kişi] *biyara gedir, muzdurçuluq da yoxdur.* "Qaçaq Nəbi". *Gəmi muzdurçuluğu filvaqe çox ağır sənətdir*. S.M.Qənizadə.

**MUZDURLUQ** *is.* 1. Muzdurun işi, peşəsi. *Muzdurluq etmək.* – *Qapılarda muzdurluq edən yurdsuz, yoxsul adam indi yavaş-yavaş zəngin həyat keçirməyə başlayırdı*. T.Ş.Simurq. [Eldar:] *Atam cavanlığında .. kənd-kənd gəzər, həm muzdurluq edər, həm də oxuyub-çalarmış.* M.Rzaquluzadə.

2. Fəhləlik. [Məşədi Əsgər] *hələ on iki yaşında olduğu halda kəsb üçün Bakıya gəlib, neft gəmilərinin birisində muzdurluğa başlamışdı.* S.M.Qənizadə.

**MUZÉY** [*lat.* – museum, əsli *yun.* museion – muzalara həsr edilmiş yer, muzalar məbədi] Tarix, incəsənət abidələrini, elmi-təbii eksponatları toplayıb mühafizə və nümayiş etdirən müəssisə. *Tarix muzeyi. İncəsənət muzeyi. Kənd təsərrüfatı muzeyi. Ölkəşünaslıq muzeyi.*

**MUZEYŞÜNAS** *is.* [*lat.* museum və *fars.* ...şünas] Muzeyşünaslıq mütəxəssisi.

**MUZEYŞÜNASLIQ** *is.* Muzeylər təşkili və işi haqqında tətbiqi elm.

**MÜADİL** *sif.* [*ər.*] *köhn.* Çəki, həcm və qiymətcə bərabər olan; bərabər, tən.

**MÜADİLƏ** *is.* [*ər.*] *riyaz.* b a x **tənlik**. *Mühəndislik üçün yalnız müadilələri və həndəsə xətlərini, riyazi davaları bilməkmi lazımdır?* Mir Cəlal.

**MÜAHİDƏ, MÜAHİDƏNAMƏ** *is.* [*ər.* müahidə və *fars.* ...namə] Müqavilə, müqavilənamə, əhdnamə, saziş. *Müahidə bağlamaq*. – [Xristofor:] *..Avtomobilə minib qaçdım, bir şirkətlə müahidə bağlayıb əmələ sifəti ilə Fransaya gəldim.* Çəmənzəminli.

**MÜAQİB** *sif.* [*ər.*] 1. Təqib edən, ardınca gedən.

2. İncidən, əzab verən, cəzalandıran.

**MÜALİCƏ** *is.* [*ər.*] 1. Xəstəni sağaltmaq üçün tibbi vasitələr tətbiq etmə. *Müalicə yaxşı nəticə verdi. – Toğrulun yarası o qədər də ağır deyil, müalicəsinə başlanmışdır.* M.S.Ordubadi. *Müalicə Tapdığı yaxşı ayağa qaldırdı*. Ə.Əbülhəsən. ☐ **Müalicə etmək** – sağaltmaq üçün tibbi vasitələr tətbiq etmək. [Molla Kazım:] *Belə arvadların çoxusunu mən müalicə etmişəm.* Ə.Haqverdiyev. **Müalicə olunmaq** – sağalması üçün tibbi tədbirlər görülmək (görmək). *Uşaq müalicə olunur. – Sağlıq olsa, sən həm müalicə olunacaq, həm dincələcəksən*. Mir Cəlal. [Aydın Səmədə:] *Siz gərək ağıllı-başlı müalicə olunasınız.* H.Seyidbəyli. // Xəstəliyi sağaltmaq üçün görülən, tətbiq edilən tədbirlər. *Qızdırmaya qarşı müalicə.*

2. Müalicə məqsədilə tətbiq olunan, müalicə ilə əlaqədar olan. *Müalicə gimnastikası. Müalicə müəssisəsi. – Xalq təsərrüfatımızın ümumi inkişafında yaylaqlarımızın, .. müalicə sularımızın, kurortlarımızın iqtisadi əhəmiyyəti böyükdür.* Ə.Vəliyev.

**MÜALİCƏXANA** [*ər.* müalicə və *fars.* ...xanə] b a x **xəstəxana**. *Müalicəxanadan qayıdıb yol ağzında avtobus gözləyən qadınlar .. vağzaldan ayrılan yola baxırdılar.* Mir Cəlal.

**MÜALİCƏPƏZİR** *sif.* [*ər.* müalicə və *fars.* ...pəzir] *köhn.* Müalicəsi mümkün olan, müalicə nəticəsində sağala bilən, sağalan. *Müalicəpəzir xəstəlik*. – [Mirzə Mehdi:] *Ancaq Gövhərtacın mərəzi müalicəpəzir mərəzlərdən deyil*. Ə.Haqverdiyev. [Yaşlı kişi:] *Çopurun müalicəpəzir olmayan dərdinin nə olduğunu mən* [Şirinnazın] *bu halından kəşf etdim*. S.Hüseyn.

**MÜALİCƏSİZ** *sif.* 1. Müalicə olunmayan. *Müalicəsiz xəstə.*

2. Müalicəsi olmayan, çarəsi, əlacı, dərmanı olmayan. *Müalicəsiz xəstəlik.*

**MÜAMİLƏ** *is.* [*ər.*] 1. *köhn.* Rəftar, münasibət, davranış. [Molla Güləndam] *qonşuların müamiləsindən .. məlumat istərdi.* Çəmənzəminli. *Xədicənin mənə qarşı .. bu müamiləsindən mütəəssir olmaya bilməzdim.* S.Hüseyn. ◻ **Müamilə etmək** – rəftar etmək, yola getmək, bu və ya başqa cür əlaqə, münasibət göstərmək. *Əsgər Züleyxanı əsla döyməzdi, söyməzdi, amma elə müamilə edərdi ki, bu, döyməkdən də, söyməkdən də betər idi.* C.Cabbarlı.

2. Alış-veriş, ticarət, alver. *Banki-şahi bu müamilədən heç bir yaxşı şey qazana bilməz.* P.Makulu.

3. İstifadə və ya borc olaraq verilən pul müqabilində alınan faiz; sələm. *Müamilə ilə pul götürmək.* – [Məşədi İbad:] [Daşdəmir bəy] *mənə iki min manat pul verəcəkdir və səkkiz yüz otuz altı manat on dörd şahı müamiləsi edir.* Ü.Hacıbəyov. [Cavad:] *Sən bəylərdən yüz manat müamilə alırsan, mənim də səndə otuz manatım qalıb.* Ə.Haqverdiyev.

**MÜAMİLƏÇİ** *is.* Faizlə pul borc verən adam; sələmçi.

**MÜAMİLƏÇİLİK** *is.* Faizlə pul borcvermə işi; sələmçilik. *Vəli malik olduğu sərvəti yalnız parçaçılıqdan deyil, müamiləçilikdən və oğurluq mal alış-verişindən qazanmışdı.* Çəmənzəminli. [Şofer:] *Keçmişdə alverlə, müamiləçiliklə, ev kirayə verməklə .. müftə pul qazanan hacılar, kərbəlayılar çox idi.* M.Rzaquluzadə.

**MÜARİZ** *sif.* və *is.* [*ər.*] *köhn.* Əks olan, zidd olan, müxalif olan, qarşı olan. [Mehriban] *bir çox fikirlərinə müariz idi.* S.Hüseyn. *Qüdrət qəsdən müarizinin dililə, rəsmi bir ahənglə danışırdı.* M.Hüseyn.

**MÜASİR** *sif.* [*ər.*] 1. Başqası və ya başqaları ilə bir əsrdə, bir zamanda, bir dövrdə yaşamış olan və ya yaşayan; həməsr. *Həsən bəy Zərdabi Mirzə Fətəli Axundzadənin müasiri idi.* // İs. mənasında adətən cəm şəklində: **müasirlərimiz** – bizimlə bir əsrdə, bir dövrdə, bir vaxtda yaşayanlar.

2. İndiki əsrdə, hazırkı dövrdə olan. *Müasir elm. Müasir ədəbi dil. Müasir dünyamızın problemləri.* // Öz dövrünə uyğun olan, öz zamanının, əsrinin tələblərinə cavab verən. *Müasir texnika. Müasir nəqliyyat vasitələri.*

**MÜASİRLƏŞDİRİLMƏ** "Müasirləşdirilmək"dən *f.is.*

**MÜASİRLƏŞDİRİLMƏK** *məch.* Müasir şəklə salınmaq, müasir dövrün tələblərinə uyğunlaşdırılmaq. // Təkmilləşdirilmək.

**MÜASİRLƏŞDİRMƏ** "Müasirləşdirmək"-dən *f.is.*

**MÜASİRLƏŞDİRMƏK** *f.* Müasir şəklə salmaq, əsrin, dövrün tələblərinə uyğunlaşdırmaq. *Geyimini müasirləşdirmək.* // Təkmilləşdirmək (ən yeni avadanlıqla, texniki vasitələrlə, maşınlarla).

**MÜASİRLƏŞMƏ** "Müasirləşmək"dən *f.is.*

**MÜASİRLƏŞMƏK** *f.* Müasir hala, şəklə düşmək; əsrin, dövrün, zamanın tələblərinə, zövqünə uyğun olaraq dəyişmək.

**MÜASİRLİK** *is.* Müasir olma; dövrün, zamanın tələblərinə uyğunluq. *Vahabzadənin başqa kamil cəhətlərindən biri də odur ki, şair öz əsərlərində tarixi müasirlik qədər yaşada bilir.* Ç.Aytmatov.

**MÜAŞİQƏ** *is.* [*ər.*] Bir-birinə aşiq olma, sevişmə, bir-birinə eşq elan etmə, eşqbazlıq. *..Güldanda məşhur xəlifə Harunərrəşidin, qadını Zübeydə xatun ilə olan müaşiqəsindən çox nəfis bir mənzərə var idi.* M.S.Ordubadi.

**MÜAVİN** *is.* [*ər.*] Rəisi, rəhbəri və b.-nı işdə, vəzifədə əvəz edən şəxsin rəsmi adı. *Direktorun müavini. Komandir müavini.* – [Mərcanov:] *Sona bizim zavodun müdir müavinidir.* H.Nəzərli. [Qarakişi Hümmətə:] *Sənə yüz dəfə dedim, o Daşdəmiri müavin qoyma. Sözümə baxmadın.* B.Bayramov.

**MÜAVİNƏT** *is.* [*ər.*] Kömək, yardım. [Cahan:] *Onların köməyilə, hökumətin müavinətilə, budur, kəndə təmiz şirin su gətirmişik.* Ə.Haqverdiyev. ◻ **Müavinət etmək** – kömək etmək, yardım göstərmək. *Mən də indi sənin kimi məzlumlara əlimdən gələn qədər müavinət edirəm.* C.Cabbarlı.

**MÜAVİNLİK** *is.* Müavin vəzifəsi. *Müavinlik etmək. Müavinlikdən çıxmaq.*

**MÜAYİNƏ** *is.* [*ər.*] 1. Hərtərəfli yoxlama, nəzərdən keçirmə, baxma. ◻ **Müayinə etmək (eləmək)** – hərtərəfli yoxlamaq, nəzərdən keçirmək, müayinədən keçirmək, ora-

burasına baxmaq. [Polis:] *Rüstəm bəy, Mirzə Məhəmməd Əli və Səməd Vahidin mənzilini axtaraq, kitablarını müayinə edək.* C.Məmmədquluzadə. *Suflyor lampanın neftini müayinə eləyir.* S.Rəhman. **Müayinədən keçirmək** – bax **müayinə etmək (eləmək)**. *Bəzən də* [Kamil] *maşınını saxlayıb müayinədən keçirərdi*. S.Vəliyev.

2. *tib.* Qulaq asmaqla, diqqətlə gözdən keçirməklə bədəni hərtərəfli yoxlama, tədqiq etmə. *Həkim müayinəni qurtarıb o biri otağa keçdi.* Mir Cəlal. *Müayinə başlanır; Qızışır həkimlərin; Məşvərəti, söhbəti*. B.Vahabzadə. ☐ **Müayinə olunmaq** – həkim tərəfindən hərtərəfli yoxlanılmaq, nəzərdən keçirilmək. *Həmin binalarda yaşayanlar ayda bir dəfə müayinə olunmağa məcburdular*. Çəmənzəminli.

**MÜBADİLƏ** *is.* [*ər.*] 1. Bir şey verib əvəzində başqa bir şey alma; deyişmə. ☐ **Mübadilə etmək** – bir şey verib, əvəzində başqa (adətən eyni dəyərdə) bir şey almaq; bir şeyi başqa bir şeyə dəyişmək.

2. *iqt.* Əmtəələrin, cəmiyyətin istehsal etdiyi dəyərlərin bölüşdürülməsi forması kimi hərəkət prosesi.

◊ **Maddələr mübadiləsi** – bax **maddə**[1].

**MÜBAH** *sif.* [*ər.*] *köhn.* 1. Dinə görə nə halal, nə də haram sayılan, edilməsi və ya edilməməsi könüllü, ixtiyari olan. *Çün gözün sərməstüləlindir şərab; Mey mübah oldu və sufilik həram*. Nəsimi. *Məni qazi sənə nikah eləsin; Bu həram əmri ol mübah eləsin.* S.Ə.Şirvani. [Hacı:] *Bütün müstəbid mollalar məşrutəçilərin qanlarını mübah, mallarını halal yazıblar.* P.Makulu.

2. Bol, bərəkətli, bolluq. *Dağlar çəkər ah sənsiz; İl olmaz mübah sənsiz; Gecələr ilə dönüb; Açılmır sabah sənsiz.* (Bayatı). [Molla Qurban:] *İnşallah, yağış da yağacaq, il də mübah gələcək, camaat!* Ə.Vəliyev.

**MÜBAHİSƏ** *is.* [*ər.*] Bir işi, məsələni və s. müzakirə etdikdə öz fikrini qoruyan, sübut etməyə çalışanlar arasında başlanan bəhs, deyişmə. *Mübahisəyə başlamaq. Elmi mübahisə. – İki qardaş arasındakı mübahisə getdikcə qızışıb axırda bir dava şəklini aldı.* A.Şaiq. *Uzun mübahisədən sonra Şahmar bir tikə çörək kəsib .. dirriyə enmişdi.* B.Bayramov. ☐ **Mübahisə açmaq** – 1) bir iş, məsələ, söz üstə deyişməyə başlamaq, bəhsə girişmək. [Qətibə:] *O zaman mən sizinlə bu barədə geniş mübahisə açmaq istəmədim.* M.S.Ordubadi; 2) elmi, yaxud başqa bir məsələni öyrənmək üçün müzakirə etmək. [Əsgər:] *Oxuduqlarınızı da yoldaşlara başa salasınız, mübahisə açasınız.* M.S.Ordubadi. **Mübahisə düşmək** – bir şey, məsələ və ya iş haqqında müxtəlif rəydə olanlar arasında sözləşmək, bəhs başlamaq. *Onların düşdü çün mübahisəsi; Ki, nədəndir zəmanə hadisəsi!* S.Ə.Şirvani. *Uzun mübahisə və deyişmə düşdü.* Mir Cəlal. **Mübahisə etmək (eləmək)** – bir şeyi, məsələni sübut etməyə çalışaraq etiraz etmək, bəhs etmək, höcətləşmək, deyişmək, sözə gəlmək. *Bir nəfər .. bir hampa kəndli ilə mübahisə eləyirdi*. Ə.Haqverdiyev. **Mübahisəyə girişmək** – bax **mübahisə açmaq**. [Nəsir] *hələ bəzi vaxt öz fikrinin üstündə duraraq böyük qardaşı ilə mübahisəyə də girişirdi.* S.Hüseyn.

**MÜBAHİSƏÇİ** *is.* Mübahisə edən, mübahisə etməyi sevən adam. *O, çox mübahisəçidir.*

**MÜBAHİSƏLİ** *sif.* Mübahisə doğuran, mübahisəyə səbəb olan. *Mübahisəli məsələ. Mübahisəli iş. – Mollanəsrəddinçilərlə füyuzatçılar arasında ilk nəzərə çarpan mübahisəli məsələlərdən biri dil məsələsi idi.* M.İbrahimov.

**MÜBAHİSƏSİZ** *sif.* Heç bir mübahisə doğurmayan, mübahisə olmayan. *Mübahisəsiz iş. Mübahisəsiz məsələ.* // Zərf mənasında. *Müzakirə mübahisəsiz keçdi.*

**MÜBALİĞƏ** *is.* [*ər.*] 1. Bir şeyi həddindən artıq şişirtmə, böyütmə, artırma. [Zeynal] *deyirdi ki, "mənim aylıq mədaxilim beş yüz manatdır". Bu sözlər, mübaliğə də olsa, həqiqətə yaxındı.* S.Hüseyn. *Mübaliğə başqa, yalan başqadır.* Qantəmir. *Demək, Qaraxanın sözündə heç də mübaliğə yoxmuş.* İ.Hüseynov. ☐ **Mübaliğə etmək** – şişirtmək, artırmaq, böyütmək (sözü, işi və s.-ni). *Şübhəsiz, Kəyan mübaliğə edirdi. O, Qulam qədər qorxmurdu.* Ə.Əbülhəsən.

2. *ədəb.* Təsvir edilən hadisənin, şeyin, vəziyyətin təsirini artırmaq üçün onları qəsdən şişirtməkdən ibarət ədəbi üsul.

◊ **Mübaliğə olmasın**... – "həqiqətən belədir", "düzü budur", "həqiqi sözümdür" və s. mənalarda işlədilən ifadə.

**MÜBALİĞƏÇİ** *is.* Mübaliğə ilə danışan, mübaliğə ilə danışmağı sevən adam. [Məmmədcəfər] *bir qədər danışığında mübaliğəçi idi, vəssalam*. Qantəmir.

**MÜBALİĞƏLİ** *sif.* Mübaliğə olan; şişirdilmiş, artırılmış. *Mübaliğəli söz. Mübaliğəli danışıq.*

**MÜBALİĞƏSİZ** *sif.* və *zərf* Mübaliğə olmayan; necə var, olduğu kimi; artırılmamış, şişirdilməmiş. *Mübaliğəsiz demək olar... –* [Rəşid:] *Mübaliğəsiz deyirəm ki, beş ildə mən onun bir dəfə düşüncəli vaxtına təsadüf etmədim.* İ.Hüseynov.

**MÜBARƏK** *sif.* [*ər.*] 1. Xoş bir xəbər, təzə alınan şey və ya bayram münasibətilə deyilən təbrik, gözaydınlıq sözü. *Bayramınız mübarək! Təzə paltarın mübarək*(*dir*)! *Toyunuz mübarək! –* [Müəllif:] *Hərdənbir uşaqlardan biri qardaşımın papağını başından alıb yerə vuranda* "*mübarək, mübarək!*" *– deyə çığırırdıq.* T.Ş.Simurq.

2. Müqəddəs, əziz, hörmətli, layiqli. *Mübarək üz. – Görürəm mən yuxumda hər axşam; O mübarək məkanı çox sevirəm.* A.Səhhət.

3. Uğurlu, xoş, yaxşı. *Məmməd bəy falı açdı. Falda görülən şeirləri farsca hacıya oxudu:* "*Çox mübarək faldır*", *– deyə hacıya müjdə verdi.* M.S.Ordubadi.

4. Bəzən istehza ilə bir adam və ya bir şey haqqında işlənir. *Oğlan tərs-tərs Səttara baxdı: – Paho! Bu mübarək haradan çıxdı? Boyuna bax, yekə-yekə danışmağına bax!* P.Makulu.

◊ **Mübarək olsun!** – b a x **Allah mübarək eləsin!** ("**Allah**"da). *Eyvanın, otağın mübarək olsun; İmarəti al qumaşdı, Annax bəy!* Aşıq Ələsgər.

**MÜBARƏKBAD** *is.* [*ər.* mübarək və *fars.* ...bad]: **mübarəkbad etmək (eləmək)** – təbrik etmək, gözaydınlığı vermək, "mübarəkdir" demək. *Elçilər mübarəkbad edib bu şad xəbəri Şahvələdə yetirdilər.* "Aşıq Qərib". [Məşədi İbad Həsənqulu bəy və başqalarına:] *Qonaqlıqda məni mübarəkbad eləmədiniz?* Ü.Hacıbəyov.

**MÜBARƏKBADLIQ** *is.* Təbrik etmə, gözaydınlığı vermə; təbrik, gözaydınlığı. *Pəri xanım və qarabaş, Əhmədin əynində nişan paltarını görəndə sevindiklərindən özlərini itirib, mübarəkbadlığı da yadlarından çıxartdılar.* (Nağıl). *Sizin toyunuzun mübarəkbadlığı da doğma övladımızın xeyir işi kimi bizə xoşdur.* Mir Cəlal. □ **Mübarəkbadlıq etmək** – təbrik etmək, gözaydınlığı vermək. *Afərin səsi asimana bülənd oldu, hamı mübarəkbadlıq elədi.* "Abbas və Gülgəz". *Hələ məclis açılmamış vəkillər bir-birilə görüşür, mübarəkbadlıq edir.* M.İbrahimov. **Mübarəkbadlıq vermək** – b a x **mübarəkbadlıq etmək**. *..Hamısı bu gün dilbir oldular ki, mənə mübarəkbadlıq versinlər ki, bu gün mənim düdüyüm səs çıxardıb.* C.Məmmədquluzadə.

**MÜBARİZ** [*ər.*] 1. *is.* Hər hansı bir (adətən qabaqcıl, mütərəqqi, ədalətli, doğru) iş və s. uğrunda mübarizə aparan, çalışan adam. *Sülh mübarizləri.* // Sif. mənasında. [Ömər Lütfi:] *Sizin kimi mübariz arqadaşlarımız da var.* H.Nəzərli. // Döyüşçü, vuruşan. [Bəhram:] *Mən də vuruşanlarla, qalib gələnlərlə bir sırada mübariz bir əsgər kimi irəliləyəcəyəm.* Ə.Vəliyev.

2. *is. köhn.* Oyunda, yarışda rəqib. *Gəldi, mübariz tələb etdi genə; Söylədi ki, kimdi bərabər mənə?* S.Ə.Şirvani. *Fəxrəddin isə topu havada əlində saxlamaqla mübariz gözləyirdi.* M.S.Ordubadi. [Qaraca qız] *rəqs etməyi olduqca sevirdi, odur ki, məclisə mübariz istəyən pəhləvan kimi atıldı.* S.S.Axundov.

3. *sif.* Mübarizəyə çağıran, mübarizə ruhlu. *Mübariz çağırış. – Dostların arasında, İtaliya torpağında; Səsləndi ən mübariz nəğmələr dodağında.* S.Rüstəm.

**MÜBARİZƏ** *is.* [*ər.*] 1. Bir-birinə zidd ictimai qrupların, əqidələrin, mənafelərin və s.-nin üstünlük, hakim mövqe tutmaq uğrunda bir-biri ilə fəal toqquşması. *Dilsiz, sağır göylərə dirək oldu haqq səsi; Başlandı bu ölkənin meydan mübarizəsi.* B.Vahabzadə. // Hər hansı məqsədə çatmaq üçün çalışma; cəhd, təşəbbüs. *İllik plan uğrunda mübarizə. Qənaət uğrunda mübarizə. – Maarif sahəsində mübarizə, əsasən, tədris ocaqlarına münasibətdə meydana çıxırdı.* A.Şaiq. *Haqq yolunda mübarizə şüarıyla çıxdım yola; Ərəb*

*qızı, bu əzmində sənə min-min uğur ola!* N.Rəfibəyli. // Bir şeyi aradan qaldırmaq, ona qalib gəlmək üçün çalışma, fəaliyyət göstərmə. *Ziyanvericilərlə mübarizə.* – [Xasay] *əynindəki nimdaş şal pencəyini çıxarıb alovla mübarizəyə başladı.* Ə.Vəliyev. [Aydın:] *Mən gəlmişəm, qızdırma ilə mübarizə aparam.* H.Seyidbəyli.

2. Vuruşma, dava, döyüş. *Böyük bir cəbhədə ölüm-dirim mübarizəsi getdikcə qızışır.* M.İbrahimov. *Vətən müharibəsi .. mərd oğullarını düşmənlə mübarizə meydanına atdı.* S.Vəliyev. // Əlbəyaxa vuruşma.

3. *məc.* Bir-birinə zidd duyğuların, meyillərin, arzuların toqquşması, bunlardan hansı birinə üstünlük verməkdə daxilən göstərilən səy. *Öz-özü ilə mübarizə.* – [Zərnigar xanım] *qəlbinin ən ucqar bir guşəsində gizlənib cücərməyə çalışan bu duyğudan qorxsa da, onun qol-qanad açıb güclənə biləcəyi ehtimalından dəhşətə gəlsə də, özü ilə mübarizə aparmağı bacarmırdı.* İ.Şıxlı.

4. İdman yarışı; yarışma. *İnadlı mübarizədən sonra neft Bakısının komandası birinci yeri tutdu.* (Qəzetlərdən).

5. *dan.* Söyüşmə, dava-dalaş, vuruşma. *Bir azdan sonra kişi bu yazığın üstünə ikinci bir arvad alardı. İki gününün arasında böyük mübarizə başlanardı.* H.Sarabski.

**MÜBARİZƏÇİ** bax **mübariz** 1-ci mənada.

**MÜBARİZƏLİ** *sif.* Mübarizə ilə başa gələn, mübarizə ilə keçən, mübarizə ilə dolu. *Mübarizəli iş. Mübarizəli ömür.* – *İnsan var ki; Ömrü qaynar, mübarizəli.* R.Rza.

**MÜBARİZƏSİZ** *sif.* Mübarizə ilə olmayan, sülh və asayişlə davam edən, keçən; dinc. *Mübarizəsiz həyat. Mübarizəsiz qələbə qazanmaq.*

**MÜBARİZLİK** *is.* Mübariz olma, müəyyən fikir və məqsəd uğrunda mübarizə aparma; döyüşkənlik. // Dotələblik.

**MÜBAŞİR[1]** *is.* [*ər.*] İranda: kəndi idarə etmək üçün mülkədarın təyin etdiyi adam. *Musa kişi mübaşir Məmmədin yoğun səsini tanıdı.* M.İbrahimov. *Ərbab mübaşiri ilə arası dəyəndən sonra onun təsərrüfatı dağılıb mal-dövləti əlindən çıxmışdı.* P.Makulu. // *köhn.* Məmur. *Sağ olsunlar qiraətxananın mübaşirləri, bir* [fənd] *qurdular ki, heç cinin də ağılına gəlməz.* "Mol. Nəsr.".

**MÜBAŞİR[2]: mübaşir olmaq** – məşğul olmaq, girişmək. [Molla İbrahimxəlil:] *Məndə hanı o qədər vaxt və fürsət ki, hər bir cüzviyyata özüm mübaşir olam.* M.F.Axundzadə. *..İki əhməq qonşu bir-birini qırmaqda ikən kazaklar da bir tərəfdən şəhəri yandırmağa mübaşir olmuşlar.* C.Məmmədquluzadə.

**MÜBƏLLİĞ** *sif.* [*ər.*] Təbliğ edən, təbliğatçı. "*Cəhənnəm məktubları*", "*Mozalan bəyin səyahətnaməsi*", "*Marallarım*" *kimi əsərlərində* [Ə.Haqverdiyev] *cəhalət, nadanlıq və köhnə etiqadlara istehza edir, xalqın ruhunu, zehnini zəhərləyən mübəlliğləri kəskin tənqid atəşinə tuturdu.* K.Məmmədov.

**MÜBHƏM** *sif.* [*ər.*] Qeyri-müəyyən, gizli, qaranlıq, naməlum, üstüörtülü, anlaşılmaz, hər cür yozula bilən, hər cür başa düşülə bilən. *Mübhəm söz.* – *Vəsl qədrin bilmədim hicran bəlasın çəkmədən; Zülməti-hicr etdi çox mübhəm işi rövşən mana.* Füzuli. [Şeyx Sədra:] *İki mübhəm sözün nə qiyməti var?! Böylə sərsəm əqidədən nə çıxar?* H.Cavid. *İçəridəki lal və mübhəm sükutu müxtəlif saatların çıxardığı zəif və ahəngdar çıqqıltı səsləri pozurdu.* A.Şaiq.

**MÜBTƏDA** *is.* [*ər.*] *qram.* Cümlənin kimin və ya nəyin haqqında danışıldığını bildirən baş üzvü. *Mübtəda kim? və nə? suallarına cavab verir.*

**MÜBTƏDALI** *sif. qram.* Mübtədası olan. *Mübtədalı cümlə.*

**MÜBTƏDASIZ** *sif. qram.* Mübtədası olmayan. *Mübtədasız cümlə.*

**MÜBTƏLA** *sif.* [*ər.*] 1. Aludə, düçar, giriftar, tutulmuş. *Kimə kim, dərdimi izhar qıldım, istəyib dərman; Özümdən həm betər bir dərdə onu mübtəla gördüm.* Füzuli. [Fərman:] *Aya, görəsən, o da mənim kimi dərdə mübtəladır, ya salamatdır?* Ə.Haqverdiyev. ☐ **Mübtəla etmək (eləmək)** – düçar etmək, giriftar etmək. *Tökür sirişk əvəzində gözüm üzə al-qan; Olubdu çünki könül zarü mübtəlası gülün.* X.Natəvan. [Əbdül:] *Allah heç kəsi qumara mübtəla eləməsin.* Ə.Haqverdiyev. **Mübtəla olmaq** – düçar olmaq, giriftar olmaq, tutulmaq. *Əziz balalar! Biz anadan təvəllüd tapıb da bu mərtəbəyə yeriş etməkdə böyük*

*zəhmətlərə, ağır məşəqqətlərə mübtəla olduq!* N.Nərimanov. [Qurbanqulu:] *Sən də, mən də, ikimiz də bir dərdə, bir qəmə mübtəla olmuşuq.* T.Ş.Simurq. **Mübtəla qılmaq** – bax **mübtəla etmək (eləmək**). *Az eyləmə inayətini əhli-dərddən; Yəni ki çox bəlalərə qıl mübtəla məni.* Füzuli. *Səbəb nə oldu məni hicrə mübtəla qıldın?* X.Natəvan.

2. Bir şeyin həddindən artıq aludəsi, düşkünü, azarkeşi. *Oğul da deyirdi: – Mən xəstəyəm, tiryəkiyəm, tərk edə bilməyirəm, mübtəlayəm.* S.Hüseyn. *Əkbər elm adamı, kitab mübtəlası da deyildi*. Mir Cəlal.

**MÜBTƏLALIQ** *is.* Bir şeyə həddindən artıq aludəlik, mübtəla olma, düçar olma, giriftarlıq.

**MÜBHƏMLİK** *is.* Gizli olma, qeyri-müəyyənlik, naməlumluq, anlaşılmazlıq. *..Şahın da, Həkimülmülkün də hərəkətlərində bir mübhəmlik, bir sirr vardı.* M.İbrahimov.

**MÜCAVİR** *sif.* [*ər.*] *köhn.* Daim ibadətxana və ya türbə yanında yaşayıb vaxtını ibadətdə keçirən adam. *Mücavir onları başına toplayıb Pirhəsənin kəramətindən uzun-uzadı söyləyir.* A.Şaiq. [Rauf:] *Əşrəf bəy bu məzarın daimi mücavirlərindəndir.* H.Cavid. // Məscid, türbə xidmətçisi. *Məscid mücaviri yüyürüb xanın ölmək xəbərini arvadına vermək istədi.* Çəmənzəminli.

**MÜCAVİRLİK** *is. köhn.* Mücavirin işi, peşəsi. *O, çayçılığı buraxıb, gedib həmin qəbirdə mücavirlik edir*. Ə.Haqverdiyev.

**MÜCADİLƏ** *is.* [*ər.*] Dava-dalaş, bir-biri ilə atışma, tutuşma, davalaşma; qovğa, dava. *Hücrədə mollalar mübahisə edirlərmiş, nə cür olursa, bunların mübahisələri mücadiləyə çevrilmiş..* "Mol. Nəsr.". // Mübarizə.

**MÜCAHİD** *is.* [*ər.*] 1. *tar.* İranda: azadlıq hərəkatında iştirak edən adama verilən ad; fədai, üsyançı. *Səttar xanın mücahidləri.* – [Bağır xan:] *Mücahidlər, igidlik və imtahan vaxtıdır*. M.S.Ordubadi. *Qorxu bilməz mücahidlər, bağrında yapa; Atıldılar vuruşlara vətən eşqilə*. S.Rüstəm.

2. *məc.* Bir məslək yolunda fədakarcasına çalışan, mübarizə edən adam; fədakar. *Bəli, təbiət həmişə Aslan kimi yüksək ruhlu, pak və saf ürəkli mücahidlər yetirir.* C.Cabbarlı. [H.Ərəblinski] *elə zənn edirdi ki, bunun ətrafına toplaşanlar artist deyil, avamlıqla, irtica ilə mübarizə aparan mücahidlərdir.* S.Rəhman.

3. Din yolunda müharibə edən, cihad edən.

**MÜCƏRRƏD** *is.* [*ər.*] Konkret varlıqla əlaqəsi olmayan, ancaq xəyalda təsəvvür edilə bilən, nəzəriyyəyə əsaslanan; abstrakt (*konkret* əksi). *Mücərrəd anlayış. Mücərrəd təfəkkür.* // Gündəlik həyatdan uzaq, konkret olmayan, həyatla bağlı olmayan. [Bir başqası:] *Əzizim, bu mücərrəd söhbətləri buraxınız.* Çəmənzəminli.

**MÜCƏRRƏDLƏŞDİRİLMƏ** "Mücərrədləşdirilmək"dən *f.is.*

**MÜCƏRRƏDLƏŞDİRİLMƏK** bax **abstraktlaşdırılmaq**.

**MÜCƏRRƏDLƏŞDİRMƏ** "Mücərrədləşdirmək"dən *f.is.*

**MÜCƏRRƏDLƏŞDİRMƏK** bax **abstraktlaşdırmaq**.

**MÜCƏRRƏDLƏŞMƏ** "Mücərrədləşmək"dən *f.is.*

**MÜCƏRRƏDLƏŞMƏK** *f.* Bir şeyin əsas, ən mühüm əlamətlərini müəyyən edib ortaya çıxartmaq üçün fikrən onun bu və ya başqa cəhətlərindən, xassələrindən və ya əlaqələrindən sərf-nəzər etmək, onları nəzərə almamaq.

**MÜCƏRRƏDLİK** *is.* Mücərrəd şeyin hal və xassəsi (*konkretlik* əksi).

**MÜCƏSSƏM** *sif.* və *is.* [*ər.*] Təcəssüm etmiş, sanki cisim halına girmiş, cisimlənmiş, canlanmış; konkret maddi bir şəkil almış. *Ey mücəssəm duyğu, ey ülvi bəşər; Ey çamırlıq içrə düşmüş saf zər!* A.Səhhət. *Mücəssəm bir xəyalət, ya həqiqətsənmi sən, cana!* M.Hadi. *Pristavın alovlu, nifrətlə dolu gözləri, dəmir yumruqları onun nəzərində mücəssəm oldu.* H.Nəzərli.

**MÜCƏSSƏMƏ** *is.* [*ər.*] 1. Hər hansı bir təbiət hadisə və ya qüvvəsinin canlı bir cisim şəklində təsviri.

2. Hər hansı bir keyfiyyəti, xüsusiyyəti təcəssüm etdirən adam, şey haqqında. *O, gözəllik mücəssəməsidir*. – [Bəhram:] *Sən insan deyilsən, bir hüsni-mücəssəmə, bir mələkixoşətvar*(*san*). C.Cabbarlı. // Surət, obraz; heykəl. // Timsal, təmsil. *Vaxtilə yalqızlıq və kədər mücəssəməsi olan Hamlet də öz sevgili*

*aktyor dostlarını belə səmimi qarşılamışdı.* M.Hüseyn. *Gənclər həmişə yüksək və təmiz xəyalların, düzlük və sədaqətin mücəssəməsidir.* M.İbrahimov.

**MÜCRİM** *is.* [*ər.*] *köhn.* Günahkar, müqəssir, təqsirli, müttəhim.

**MÜCRÜ** *is.* Balaca sandıqça. *Taxçaya düzülübdü bir neçə boğça, köhnə papaq və bir-iki mücrü.* C.Məmmədquluzadə. *Bir gün Həsənin əli dinc qalmayıb mücrünün dibinə girdi.* B.Talıblı.

**MÜCTƏHİD** *is.* [*ər.*] Dini qanunları və ehkamları təfsir və şərh etmək səlahiyyətinə malik baş ruhani. *Müctəhidin fitvası.* – [Hacı Kamyab:] *Hacı Mirzə Əhməd ağa müctəhidin qayınatası olmaq böyük şərafətdir.* Ə.Haqverdiyev. *Şərqin müctəhidi ilə Qərbin diplomatı bu gecə hər məsələdən danışdılar.* Qantəmir.

**MÜCTƏHİDLİK** *is.* Müctəhidin işi, vəzifəsi.

**MÜDAFİƏ** *is.* [*ər.*] 1. Özünü və ya başqasını hücumdan qoruma, hücuma qarşı durma. *Müdafiə üçün lazımi qədər qüvvəmiz var. Müdafiə vəziyyətində olmaq.*

2. Birinin əleyhinə deyilən sözlərə cavab verməklə onun tərəfini saxlama, ona tərəf çıxma. *Sədrin müdafiəsindən ruhlanan Lal Hüseyn daha da həyasızlaşdı.* M.İbrahimov.

3. Düşməni dəf etmək üçün lazımi vasitələrin məcmusu. *Ölkənin müdafiəsini qüvvətləndirmək.* // Düşmən hücumundan qorunmaq üçün tikintilər, qurğular sistemi, qorunma vasitələri (istehkam, səngər və s.). *Düşmənin müdafiəsini yarmaq.*

4. Tənqidə, etiraza qarşı dayanma, öz fikrinin üstündə durma, ondan dönməmə.

5. Elmi mübahisə və müzakirələrdə müəyyən nöqteyi-nəzəri, fikri isbat etmə, isbat etməyə çalışma. *Dissertasiya müdafiəsi.*

6. *hüq.* Məhkəmə prosesində müdafiə edən tərəf (*ittiham* qarşılığı). *Müdafiənin etirazı.*

7. *idm.* Futbol, xokkey və b. oyunlarda komandanın, meydanın müəyyən sahəsini qoruyan, müdafiə edən hissəsi.

**MÜDAFİƏÇİ** *is.* 1. Müdafiə edən, qoruyan, qoruyucu. *Sülh müdafiəçiləri.* – *Müdafiəçilər pulemyotu işə saldılar.* Mir Cəlal.

2. *hüq.* Vəkil, advokat. *Sonra müdafiəçilər danışdılar.* S.Hüseyn.

3. *idm.* Futbol, xokkey və b. oyunlarda müdafiədə oynayan adam.

**MÜDAFİƏSİZ** *sif.* və *zərf* Müdafiəsi olmayan, müdafiə edilməyən. *Müdafiəsiz şəhər.* – *İndi ananın yarıçılpaq bədəni şaxta qarşısında müdafiəsiz qalmışdır.* Ə.Məmmədxanlı.

**MÜDAXİLƏ** *is.* [*ər.*] 1. Başqasının işinə, münasibətinə qarışma, ümumiyyətlə, bir işə qarışma, onda iştirak etmə, onun gedişinə təsir etmə. *Başqalarının bu işə müdaxiləsinə ehtiyac yoxdur. Onun müdaxiləsi vəziyyəti daha da pisləşdirdi.* ☐ **Müdaxilə etmək** – başqasının işinə qarışmaq, araya girmək. [Məsmə:] [Kor Seyid] *mənim işlərimə müdaxilə etməyə başladı.* S.Hüseyn. [Uşaqlar] *nə isə anlayır, lakin böyüklərin dərdinə müdaxilə etməyə cəsarət etmirdilər.* Ə.Məmmədxanlı. // Bir şeyin qarşısını almaq, onu dayandırmaq üçün göstərilən fəaliyyət, hərəkət. *Cərrahi müdaxilə. Operativ müdaxilə.*

2. Bir dövlətin zorla başqa bir dövlətin daxili işlərinə qarışması. *Hərbi müdaxilə. İqtisadi müdaxilə.*

**MÜDAXİLƏÇİ** *is.* Zorla başqa bir dövlətin daxili işlərinə qarışan (dövlət və s.). *Budur, .. xaricdən gələn müdaxiləçilər darmadağın edilmişlər.* S.Rəhimov.

**MÜDAXİLƏÇİLİK** *is.* Başqasının işinə qarışma, müdaxilə etmə. *Müdaxiləçilik siyasəti.*

**MÜDAM** *zərf* [*ər.*] Daim, həmişə, müttəsil, aramsız, fasiləsiz, fasilə vermədən. *Ay bimürvət, məgər daşdır cigərin! Müdam sızıldaram, heç usanmazsan!* M.P.Vaqif. *Beş ildir alovlar, odlar içində; Bir görüş eşqiylə yanmışam müdam.* Z.Xəlil.

**MÜDAVİM** *is.* [*ər.*] Bəzi məktəblərdə: tələbə, şagird. *Kurs müdavimi. Hərbi məktəb müdavimi.* – *Dərs dediyim müdavimlər həyat görmüş, mübarizə və döyüşlərdə iştirak etmiş, bərkimiş işçilərdi.* S.Rəhimov.

**MÜDARA** *is.* [*fars.*] *köhn.* Kin və ədavətini gizlədib zahirdə dostluq göstərmə; üzə gülmə, yollaşma. *İş islah və müdaradan keçdi.* M.F.Axundzadə. ☐ **Müdara etmək** – istəmədiyi adamla birtəhər keçinmək, ürəyində olan kin və küdurəti gizlədib üzdə dostluq

göstərmək, yola vermək. *Yaşırıb saxlardım eldən daği-hicranın, əgər; Etmək olsaydı müdara dideyi-giryan ilə.* Füzuli. *Nə müşküldür ki, asan olmaya tədric ilə, Zakir; Müdara etmək olsaydı əgər müddət fəraq ilə.* Q.Zakir. **Müdara ilə** – 1) xoşluqla, zahirən dostluq göstərərək. [Molla Xəlil] *işi sülhlə, müdara ilə həll etmək istəmişdi.* S.Hüseyn; 2) qənaətlə, birtəhər. *Müdara ilə dolanmaq*.

**MÜDARAÇI** *sif.* Müdara edən, özünü zahirdə dost göstərən, üzə gülən. *Bir müdaraçı hərifdir o, inan; Yardım olmaz bizə hər alçaqdan.* H.Cavid.

**MÜDDƏA** *is.* [*ər.*] 1. Bir şeyə əsaslanaraq irəli sürülən fikir, iddia, tezis. *Dialektik materializmin müddəaları. Nəzəri müddəa.*

2. *köhn.* Arzu, istək, məqsəd, niyyət, fikir. *Əgər can almaq isə müddəası; Fədası hasil olsun, tək rizası*. Əmani. *Nə çıxsın yoxdan, ey dil, bir usan, bu müddəadan keç.* S.Ə.Şirvani.

3. B a x **müddəi** 1-ci mənada.

**MÜDDƏİ** *is.* [*ər.*] *köhn.* 1. *hüq.* İddia edən, tələb edən, tələbkar, iddiaçı. // Prokuror. *Müddəinin tələbi. – Cəmilə* [azərbaycanca] *və rusca olaraq bir müddəi kimi danışıb deyirdi: – Biz gərək xalq malına öz malımız kimi baxaq!..* S.Hüseyn. *Sanki müddəilərdən sonra hakim danışacaq, bu vaxta qədər söylənmiş ittihamlara dair öz ədalətli hökmünü bildirəcəkdi.* M.Hüseyn.

2. *klas.* Düşmən, rəqib, bədxah. *Gər sənə əfğanimi bihudə dersə müddəi; Ol sözə tutma qulaq, mən çəkdiyim əfğanə tut!* Füzuli. [Əvvəlinci:] *Bu hökmranların hamısı biri-birilə müddəidir*. Ə.Haqverdiyev. ☐ **Müddəi çıxmaq** – ədavətə başlamaq, düşmənçilik etmək. [Səkinə xanım:] *Bu bihəya qardaşımın arvadı mənə müddəi çıxıb pulun yetişməyini təxirə saldı.* M.F.Axundzadə. **Müddəi olmaq** – düşmən olmaq; ədavət etmək. *İki axund ad və şöhrət üstə həmişə bir-birilə müddəi olarlar*. C.Məmmədquluzadə.

**MÜDDƏİYİ-ÜMUMİ** *is.* [*ər.*] *köhn.* Prokuror. *Silistçi, müddəiyi-ümumi və doktor nəşlər olan otağa girib, nəşləri müayinə etdikdən sonra protokol yazıldı.* E.Sultanov. *Əvvəl müddəiyi-ümumi danışdı*. S.Hüseyn.

**MÜDDƏT** *is.* [*ər.*] 1. Bir işin, hadisənin başlanması ilə qurtarması arasındakı, yaxud bir şey üçün müəyyən edilmiş vaxt, zaman. *Təhsil müddəti.* – [Qadın:] *Molla, məni günaha batırdın, siğənin müddəti çoxdan tamam olmuşdur*. Çəmənzəminli. [Rəhim:] *Parovozun adi təmirinə 96 saat tələb olunduğu halda, biz təmir müddətini 24 saata endirdik.* Ə.Sadıq. // Ümumiyyətlə, vaxt, zaman. ☐ **(Bir) az müddət** – az zaman, az vaxt. *Az müddət içərisində dil öyrəndi.* – [Dərviş] .. *bərk köksünü ötürüb bir az müddətdən sonra məndən sordu*. A.Divanbəyoğlu. [Göyərçin:] *Böyük bir saray az müddətdə tikilib başa gələ bilər*. Z.Xəlil. **Bir müddət** – bir neçə vaxt, bir zaman, bir qədər. *Bir müddət gözləmək. – Bir müddət işlədikdən sonra bəy* [Nəbinin] *haqqını kəsir*. "Qaçaq Nəbi". *Teymur bir müddət dalanın ağzında dayanıb nə edəcəyini bilmədi.* H.Seyidbəyli. **(Bir) neçə müddət** – b a x **bir müddət**. *Bir övrət bir kişi ilə neçə müddət yaşayandan sonra bunların övladı olur.* C.Məmmədquluzadə. *Beləliklə, İskəndər bəy dağlarda neçə müddət padşahlıq elədi.* Ə.Haqverdiyev. **Bu müddət(də)** – bu dövr(də), bu vaxt(da).

2. Mövsüm. *Ov müddəti. Əkin müddəti*.

**MÜDDƏTLİ** *sif.* Müəyyən müddət üçün nəzərdə tutulmuş; vaxtlı.

**MÜDƏBBİR** *is.* [*ər.*] Tədbirli, uzaqgörən.

**MÜDƏRRİS** *is.* [*ər.*] *köhn.* Müəllim, dərs verən adam. *Mədrəsə içrə müdərris verdiyi min dərsdən; Yey durur meyxanədə bir cam vermək bir gözəl.* Füzuli. *Bizlərdə şəyirdə tema verib yazı yazdırmaq adəti rus müdərrislərindən götürülüb.* C.Məmmədquluzadə. *Müdərrislərimiz ondakı .. məharətə qibtə edərlərdi.* İ.Əfəndiyev.

**MÜDƏRRİSLİK** *is. köhn.* Müəllimlik. *Müdərrislik etmək. – On-on iki il bundan irəli Məşədi* [Molla Həsən] *İrəvanda başına yeddi-səkkiz müsəlman uşağı yığıb müdərrislik elərdi.* C.Məmmədquluzadə.

**MÜDHİŞ** *sif.* [*ər.*] Dəhşətli, dəhşət doğuran, vahiməli, dəhşətamiz, qorxunc. *Qafqaz altımdadır, ən müdhiş olan zirvədə mən.* A.Səhhət. [Şeyda:] *İnan ki, əfv etmək intiqam almaqdan daha müdhişdir*. H.Cavid. *İndi məndə Xədicəyə qarşı müdhiş bir kin vardı*. S.Hüseyn.

**MÜDHİŞLİK** *is.* Dəhşətlilik, vahiməlilik, qorxuncluq.

**MÜDİR** *is.* [*ər.*] Bir idarəni, müəssisəni idarə edən adam, idarə başçısı; direktor. *Klub müdiri. – Qeyz ilə durmuş ortalıqda müdir; İmtahan yazısın edir təqdir.* A.Səhhət. *Sabahı gün Mirzə naçalnikdən izin alıb məktəb müdirinin yanına getdi.* Ə.Haqverdiyev. *Nərgiz özü isə kənd kitabxanasının müdiri olduğundan işə bir saatdan sonra gedəcəkdi.* M.Hüseyn. // Bir idarənin, müəssisənin və s. müəyyən sahəsinə, hissəsinə rəhbərlik edən adam. *Təsərrüfat hissə müdiri. Şöbə müdiri.*

**MÜDİRƏ** *is.* [*ər.*] Qadın müdir. *..Reyhan xanım qızı ilə bərabər müdirənin otağına daxil oldu.* T.Ş.Simurq. [Gilan qızı:] *Küçə qapısı ağzında oturub müdirəmizin əri ilə danışırdınız.* S.Hüseyn. *Bağça müdirəsi dil-ağız etdi.* M.İbrahimov.

**MÜDİRİYYƏT** *is.* [*ər.*] Bir idarənin, müəssisənin, məktəbin başda müdir olmaq üzrə rəhbərlik edən yüksək orqanı; direksiya. *Müdiriyyətə müraciət etmək. – Nəhayət, nə müəllimlər, nə sinif rəhbəri, nə də müdiriyyət* [Varisin] *başıpozğunluğunun qarşısını ala bilmədiklərindən məktəbdən qovuldu.* A.Şaiq. [Vəzirbəyli] *çox cəhətdən müdiriyyətin işini bəyənmirdi.* Mir Cəlal.

**MÜDİRLİK** *is.* Müdir vəzifəsi. *Müdirlikdən çıxarılmaq.* – [Uğurlu:] *Mən öz müdirlik yerimi Əmiraslan babaya verirəm.* S.Rəhimov. // B a x **müdiriyyət**.

**MÜDRİK** *sif.* [*ər.*] 1. Dərin dərrakəli, çox ağıllı, çox dərin düşünən; aqil, dünyagörmüş; anlayan, dərk edən, kamala yetmiş, yetişmiş. *Müdrik adam. Müdrik filosof.* – [Məryəm:] *Diribaş, müdrik, həmişə şad qız indi qeyritəbii bir halda ciddiləşmişdi, vaxtsız qocalmışdı.* Çəmənzəminli.

2. Dərinmənalı, hikmətli, dərinfikirli, ağıllı. *Müdrik məsəllər. Müdrik söz. – Qəhrəman dəryazçı ilə görüşüb aralandı və xalq hikmətinin müdrik mənasını təqdir etdi.* S.Rəhimov.

**MÜDRİKCƏSİNƏ** *sif.* və *zərf* Müdrik kimi, ağıllıcasına. *Müdrikcəsinə söyləmək. Müdrikcəsinə məsləhət.*

**MÜDRİKLİK** *is.* 1. Böyük ağıl və dərrakə sahibi olma; aqillik. [Zeynəb] *diribaşlığı və müdrikliyi ilə ata-anasının heyrətinə səbəb olardı.* Çəmənzəminli.

2. Dərinmənalılıq, hikmətlilik. *Sözün müdrikliyi.*

**MÜƏLLİF** *is.* [*ər.*] Ədəbi, bədii, elmi və başqa əsər yazan və ya tərtib edən adam. *Kitabın müəllifi. M.F.Axundzadə bir neçə komediyanın müəllifidir. – C.Cabbarlının ilk pyeslərindən olan* “*Nəsrəddin şah*” *da gənc müəllifin maraqlı əsərlərindəndir.* M.Arif. “*Azərbaycan*” *qəzeti .. yeni-yeni müəlliflərin məqalə və çıxışlarını dərc edir.* M.İbrahimov. // Layihə, ixtira yaradan adam. [Bəhlul:] *Mənə elə gəldi ki, bütün qurğuların müəllifi Nicatdır.* B.Bayramov.

**MÜƏLLİFLİK** *is.* Bir əsərin müəyyən müəllifə aid olması. *Müəlliflik şəhadətnaməsi. Müəlliflik hüququ.*

**MÜƏLLİM** *is.* [*ər.*] 1. Məktəbdə hər hansı bir fəndən dərs deyən adam. *Azərbaycan dili müəllimi. Tarix müəllimi.* ☐ **Müəllimlər otağı** – məktəbdə müəllimlər üçün ayrılmış otaq. *Tənəffüs zəngi vurulan kimi Tərlan sinifdən çıxdı, o biri yoldaşlarından əvvəl müəllimlər otağına gəldi.* M.Hüseyn. *Qoca arvad oğlunun qolundan yapışaraq qorxa-qorxa müəllimlər otağına daxil oldu.* S.Rəhman. // Nəsihət verən, öyüd verən, öyrədən, ağıl verən.

2. Hörmət üçün adlara qoşularaq deyilir.

3. Hər hansı sahədə nüfuz sahibi olan, başqalarına təsir edən, nümunə ola bilən adam; ustad. *Nizami Füzulinin müəllimidir.*

**MÜƏLLİMƏ** *is.* [*ər.*] Qadın müəllim. *Sonanın ibtida müəlliməsi nəhayətdə də ağıllı və pedaqoji elminə qabil bir arvad idi.* N.Nərimanov. *Atasını görməmişdi körpə Əmirxan; Anasısa bir ağsaçlı müəlliməydi.* S.Vurğun.

**MÜƏLLİMLİK** *is.* Müəllim vəzifəsi, müəllim sənəti, işi. *Müəllimlik etmək. Müəllimliyi bacarmaq. – Çoxları sair qulluqdan müəllimliyə keçməyə meyil və rəğbət göstərərlər.* F.Köçərli. *Əjdər .. öz doğma kəndlərinə müəllimliyə getmişdi.* Ə.Məmmədxanlı.

**MÜƏMMA** *is.* [*ər.*] 1. Mənası gizli, çətin anlaşılan, üstüörtülü, qaranlıq söz, məsələ, şəkil və s. *Bu sözlər Məcidin ürəyinə yağ kimi yayılırdı və onu çətin bir müəmmanın həllindən azad edirdi.* B.Talıblı. [Hidayət] *üçün*

*heç bir müəmma, açılmaz düyün qalmamışdı.* B.Bayramov. // *məc.* Anlaşılmaz sirr, həlli çətin məsələ, şey. *Bu lap müəmmadır ki...*

2. *ədəb.* Hərf və rəqəmlərlə ifadə olunan klassik şeir formalarından biri; mənzum tapmaca. *Füzulinin müəmmaları. – Sirri-dəhaniyarı, könül, axtar, özün tap; Söz yox ki, açıb şəxsə müəmmanı deməzlər.* S.Ə.Şirvani.

**MÜƏMMALI** *sif.* Müəmması olan, aydın olmayan, üstüörtülü, başa düşülməyən, naməlum, sirli, anlaşılmaz, qaranlıq. *Müəmmalı söz. Müəmmalı* (z.) *danışmaq. Müəmmalı iş. – Qüdrət Lalənin başqa, daha ciddi və müəmmalı bir səbəbdən bu cür tutqunlaşdığını duymamış deyildi.* M.Hüseyn. *..Abdulla bu qıza müəmmalı bir meyil salmağa başlamışdı.* B.Bayramov.

**MÜƏMMASIZ** *sif.* Müəmması olmayan; aydın, açıq, aşkar. *Müəmmasız* (z.) *danışmaq.*

**MÜƏNNƏS** *is.* [*ər.*] Ərəb qrammatikasında: qadın cinsi.

**MÜƏSSİR** *sif.* [*ər.*] Təsir edən, təsirli, dərin təsir bağışlayan.

**MÜƏSSİS** *is.* [*ər.*] Təsis edən, əsasını qoyan, düzəldən, yaradan. [Səttarxan:] *Seyid Abdulla birinci məşrutəçi, bəlkə də məşrutənin müəssislərindən biridir.* P.Makulu.

◊ **Müəssislər məclisi** – b a x **məclisi-müəssisan**.

**MÜƏSSİSƏ** *is.* [*ər.*] 1. İstehsalat və ya ticarət-təsərrüfat vahidi, yaxud bir neçə belə vahidin birləşməsi. *Sənaye müəssisəsi* (*zavod, fabrik*). *Ticarət müəssisəsi.*

2. Hər hansı fəaliyyət sahəsinə baxan təşkilat; idarə. *Dövlət müəssisəsi. Elmi müəssisə. – Zeynal müəssisələrin birində orta bir vəzifə daşıyırdı*. S.Hüseyn.

**MÜƏTTƏR** *sif.* [*ər.*] *köhn.* Ətirli, ətirlənmiş.

**MÜƏYYƏN** *sif.* [*ər.*] 1. Qəti olaraq təyin edilmiş, müəyyənləşdirilmiş. *Müəyyən saatda görüşmək. Müəyyən adam.* // Müvafiq, lazımi. *Firidun müəyyən yerlərə zəng etdi*. Mir Cəlal. *Yarım saatdan sonra təzədən milis şöbəsindən gəlib müəyyən yoxlamalar aparmağa başladılar.* H.Seyidbəyli. ☐ **Müəyyən etmək** – b a x **müəyyənləşdirmək**. *Nərminə də ona görə susmuşdu ki, sözü haradan başlamağı müəyyən edə bilmirdi*. B.Bayramov. **Müəyyən olunmaq** – qabaqcadan təyin olunmaq; müəyyənləşdirilmək. *Xacə Mübarəkə əmr olundu ki, cümləsini haman saat Qəzvinin altıncı küçəsinin başında müəyyən olunan bir evə piyadə yetirsin...* M.F.Axundzadə.

2. Dürüst, aydın, dəqiq, qəti. *Fikirsiz və müəyyən plansız bir halda küçə ilə getdim.* Çəmənzəminli. *Rənada da Cahangir haqqında müəyyən bir nöqteyi-nəzər vardır.* S.Rəhman. // Konkretləşdirilmiş, konkret. *Hər kəsin vəzifəsi müəyyəndir.*

3. Bir hissə, bir qədər. *Kitabın müəyyən hissəsi.*

**MÜƏYYƏNEDİCİ** *sif.* Aydınlaşdıran, müəyyən edən, təyin edən, konkretləşdirici, dəqiqləşdirici. *Müəyyənedici səbəb.*

**MÜƏYYƏNLƏŞDİRİLMƏ** “Müəyyənləşdirilmək”dən *f.is.*

**MÜƏYYƏNLƏŞDİRİLMƏK** *məch.* Müəyyən olunmaq, aydınlaşdırılmaq, qəti şəklə salınmaq, konkretləşdirilmək, dəqiqləşdirilmək.

**MÜƏYYƏNLƏŞDİRMƏ** “Müəyyənləşdirmək”dən *f.is.*

**MÜƏYYƏNLƏŞDİRMƏK** *f.* Müəyyən etmək, təyin etmək, aydınlaşdırmaq, qəti şəklə salmaq, konkretləşdirmək, dəqiqləşdirmək. *Vaxtı müəyyənləşdirmək. Kitabları müəyyənləşdirmək. – Xoşqədəm çay süzürdü. Mən isə əlavələrin yerini müəyyənləşdirirdim.* Ə.Vəliyev. [Xanmuradov:] *Hər kəsi tanımaq, hər kəsin kollektivdəki yerini müəyyənləşdirmək lazımdır.* Ə.Sadıq.

**MÜƏYYƏNLƏŞMƏ** “Müəyyənləşmək”dən *f.is.*

**MÜƏYYƏNLƏŞMƏK** *f.* Müəyyən olmaq, dürüstləşmək, dəqiqləşmək, aydınlaşmaq, qəti şəkil almaq, konkretləşmək. *Payızdır, lakin əsil payız havası müəyyənləşməmişdir*. Mir Cəlal.

**MÜƏYYƏNLİK** *is.* Müəyyən olma; aydınlıq, qətilik. *İşin müəyyənliyi.*

**MÜƏZZƏM** *sif.* [*ər.*] 1. *tənt.* Əzəmətli, böyük, cəsamətli, möhtəşəm. *Müəzzəm heykəl. Müəzzəm saray. – İnqilab .. müəzzəm bir bina üçün zəmin hazırlarkən yeni quruluşu anlamayan, ona uya bilməyən Məhəmməd bəy kədər içində boğulub məhv olurdu.* Çəmənzəminli.

2. *klas.* Çox hörmətli, ehtiramlı, alicənab, şan və şövkət sahibi. *Müəzzəm şəxs. – Dövran oları müəzzəm etdi; Hər dövr birin mükərrəm etdi.* Füzuli.

**MÜƏZZİN** *is.* [*ər.*] Azançı. *Badamlı qəsəbəsinin müəzzini çox həzin səs ilə oxuyurdu.* C.Məmmədquluzadə. *Müəzzinin səsinin hər pərdəsi Həsənin sevdiyi sənətindən bir xatirat idi.* B.Talıblı.

**MÜƏZZİNLİK** *is.* Azançılıq.

**MÜFƏSSƏL** *sif.* və *zərf* [*ər.*] Ətraflı, təfsilatlı, geniş (*müxtəsər* ziddi). *Müfəssəl məktub. Müfəssəl danışmaq.* – [Ələsgər:] *Əhvalatın hamısını mən yaxşı bilirəm. Tamam müfəssəl mənə nağıl ediblər.* Ə.Haqverdiyev. [Müəllim:] *Siz yuxarı sinifdə tarix dərslərində onun haqqında müfəssəl məlumat alacaqsınız.* Ə.Məmmədxanlı.

**MÜFƏSSƏLLİK** *is.* Müfəssəl olma; ətraflılıq, təfsilatlılıq, hərtərəflilik, genişlik. *Məlumatın müfəssəlliyi.*

**MÜFƏTTİŞ** *is.* [*ər.*] Təftiş aparan vəzifəli şəxs; təftişçi. *Maliyyə müfəttişi. Avtomobil müfəttişi.* – [Oğlan:] *Bilirəm, siz də müfəttişin tərəfini tutacaqsınız! – dedi.* A.Şaiq.

**MÜFƏTTİŞLİK** *is.* 1. Müfəttişin vəzifəsi, işi. *Deyirlər, müfəttişlik xoşuna gəlmir.* Mir Cəlal.

2. Yoxlama, nəzarət işi aparan idarə. *Müfəttişliyə getmək. Müfəttişlikdə işə girmək. – Avtomobil müfəttişliyi hərəkətə gəldi.* H.Seyidbəyli.

**MÜFLİS** *sif.* [*ər.*] 1. İflasa uğramış, iflas etmiş, sınıq çıxmış (b a x **iflas** 1-ci mənada). ☐ **Müflis olmaq** – b a x **müflisləşmək** 1-ci mənada. [Dilara:] *Cavanşir bəy müflis olmuş Qarabağ bəylərindən birinin oğlu idi.* Ə.Məmmədxanlı.

2. Var-yoxu əlindən çıxmış, yoxsullaşmış, kasıb düşmüş. *Zarafat deyil, qırx ildə əziyyət çəkib yığdığın dövlət bir gündə əldən gedə, qalasan müflis.* N.Vəzirov. ☐ **Müflis olmaq** – b a x **müflisləşmək** 2-ci mənada. *Bədxərclikdən müflis oldu.*

**MÜFLİSLƏŞDİRMƏ** "Müflisləşdirmək"-dən *f.is.*

**MÜFLİSLƏŞDİRMƏK** *f.* Var-yoxunu əlindən çıxartmaq, müflis olmağına səbəb olmaq, iflasa uğratmaq.

**MÜFLİSLƏŞMƏ** "Müflisləşmək"dən *f.is.*

**MÜFLİSLƏŞMƏK** *f.* 1. İflasa uğramaq, iflas etmək.

2. Var-dövlətini itirmək, var-dövləti əlindən çıxmaq, müflis olmaq.

**MÜFLİSLİK** *is.* Müflis olma, var-yoxu, pulu, malı əlindən çıxma, iflasa uğrama.

**MÜFRƏD** *is.* [*ər.*] Qrammatikada: "tək"in köhnə adı (*cəm* qarşılığı).

**MÜFSİD** *sif.* [*ər.*] *köhn.* Araqarışdıran, fəsad törədən, fitnəkar. *Bir növ ilə öz fikrinizi soxduz arayə; Ta çatdı xəbər bir para müfsid üləmayə...* M.Ə.Sabir.

**MÜFTƏ** *sif.* [*fars.*] Pulsuz, havayı, əvəzinə heç bir şey verilməyən; məccani. *Müftə sirkə baldan şirindir.* (Ata. sözü). [Heydər bəy:] *Məyər Təbrizdə müftə mal tökülübdür, gedib yığışdırıb gətirək gələk?* M.F.Axundzadə. // Zərf mənasında. *Bəzi yerlərdə təsadüf olunur aşa, ətə; Müftə görcək tuturam kəndimi bozbaşa, ətə.* M.Ə.Sabir. [Məşədi İbad bəylərə:] *Kişinin hamamında iki saatdır ki, müftə çimibsiniz, hələ bir durub cəncəl də salırsınız?* Ü.Hacıbəyov.

**müftə-müftə** *zərf* Boş-boş, havayı-havayı, nahaq yerə. *Müftə-müftə "Nicat", "Məktəb" demək ilə Fatıya tuman olmaz.* C.Məmmədquluzadə.

**MÜFTƏCƏ** *zərf* və *sif.* 1. Müftə olaraq, havayı, pulsuz-parasız, məccani. *Müftəcə işləmək.* – [Pristav qorodovoylara:] *Müftəcə məvacib alıb, il uzunu bircə qəpikliksə də iş görmək istəmirsiniz.* Çəmənzəminli.

2. *məc.* Boş yerə, əbəs yerə, boş-boşuna. *Boşla, xala, cəfəngini; Müftəcə yorma əngini.* Ə.Nəzmi.

**MÜFTƏXOR** *is.* [*fars.*] Özü zəhmət çəkməyib başqalarının hesabına yaşayan adam; tüfeyli, parazit. [Fərhad:] *Özgənin zəhməti ilə çörək yeyənlərə müftəxor deyirlər.* Ə.Haqverdiyev. // Sif. mənasında. [Cəlaləddin:] *Kənar edin hökumət başında oturan müftəxor vəzirləri, çağırın millət nümayəndələrini.* C.Cabbarlı.

**MÜFTƏXORLUQ** *is.* Özü işləməyib başqalarının hesabına yaşama; tüfeylilik, parazitlik. [Laçın bəy:] *Cəminin hərəkətləri olub yalan, büxl, şivə, müftəxorluq.* N.Vəzirov.

**MÜFTİ** *is.* [*ər.*] 1. Sünnilərin dini işlərinə rəhbərlik edən baş ruhani. *Müftinin hörmətin tutub mənzur; Ora göndərdilər böyük bir zat.* Ə.Qəmküsar. [İkinci qulam:] *Gəlmək istər hüzurə bir müfti.* H.Cavid.

2. Hüquq məsələlərində hökm vermək ixtiyarı olan yüksək rütbəli müsəlman ruhanisi.

**MÜFTİLİK** *is.* Müfti vəzifəsi. *..Orenburq müftiliyinə senator .. təyin olunur və Orenburq müftisi cənab Sultanov jandarm qulluğuna keçir.* C.Məmmədquluzadə.

**MÜĞAYİR** *sif.* [*ər.*] Uyğun olmayan, düz gəlməyən, müvafiq olmayan; zidd, əks, müxalif. [Rza bəy Məşədi İbada:] *O cür şey məsləkimə müğayirdir.* Ü.Hacıbəyov. *..Uşaqları özləri ilə bir otaqda yatırmaq tərbiyəyə müğayir bir hərəkət olardı.* S.Hüseyn.

**MÜĞƏNNİ** *is.* [*ər.*] Oxuyan, xanəndə. *Müğənni yeni mahnı oxudu. Müğənnini alqışlamaq. – Bir nəğmə çalın ki, heyrətdə qalsın; Bütün dövrlərin müğənniləri.* M.Müşfiq. *Əlindən iş gəlməyən; Söz ilə basıb-kəsən quru bəyə bənzərik; Oxuduğu sözlərin mənasını bilməyən; Müğənniyə bənzərik.* B.Vahabzadə. *Get, a nazəndə müğənni, apar öz tarını da; Gedib artıq şüurum, şur ilə şahnazım yox.* Şəhriyar. // Sif. mənasında. *Müğənni qız.*

**MÜĞƏNNİLİK** *is.* Müğənni sənəti, xanəndəlik.

**MÜHACİR** *is.* [*ər.*] 1. Siyasi, iqtisadi və ya dini səbəb üzündən vətənini tərk edib başqa ölkəyə köçən və orada yaşayan adam. *Siyasi mühacir.*

2. Yeni yerə, yeni torpaqlara köçən və ya köçürülən adam. *Vətənçin burnunun ucu göynəyən; Adamlar görmüşəm nə qədər desən; Bu vətən nisgilli mühacirlərin; Acı taleyinə acımışam mən..* B.Vahabzadə.

**MÜHACİRƏT** *is.* [*ər.*] 1. Siyasi, iqtisadi və ya dini səbəbdən məcburi və ya könüllü olaraq öz vətənini tərk edib başqa ölkəyə köçmə. ◻ **Mühacirət etmək** – öz vətənini tərk edərək başqa ölkəyə köçmək. *Doktor hələ çar zamanı Rusiyadan Təbrizə və oradan da Tehrana mühacirət etmiş azadfikirli bir həkim idi.* M.İbrahimov.

2. Mühacirət nəticəsində xaricdə yaşama. *Paralar isə elə boldur ki, onunla bütün mühacirətdə olan yoldaşları təmin edə bilərik.* M.S.Ordubadi.

3. *top.* Mühacirlər.

**MÜHACİRLİK** bax **mühacirət** 1 və 2-ci mənalarda.

**MÜHAFİZ** *is.* [*ər.*] Mühafizə edən, qoruyan; mühafizəçi, keşikçi. [Ələmdar] *bir küncə çəkilib özünü başqa rəislərin mühafizləri arasına saldı.* S.Rəhimov. [Yusif:] *Məhsəti xanımı mühafizlər dövrəyə alıblar.* M.Hüseyn.

**MÜHAFİZƏ** *is.* [*ər.*] Hücumdan, təhlükədən, zərbədən, qəsddən və s.-dən qoruma, saxlama. [Qadın] *sol əlini başının qarşısına tutmaqla özünü üzərinə enməkdə olan ağacdan mühafizəyə çalışırdı.* S.Hüseyn. *..Mərcan nənə nə fikirləşdisə də uşağı bombadan mühafizə yerinə apardı.* Mir Cəlal. ◻ **Mühafizə etmək (eləmək)** – hücumdan, zərbədən və s. təhlükədən qorumaq, saxlamaq. *Vətəni düşmənlərdən mühafizə eləməyə bu tayfanın qabiliyyəti yoxdur.* C.Məmmədquluzadə. // Pis, zərərli və ya istənilməyən bir şeyin təsirindən qoruma (qorunma). *Xəstəlikdən mühafizə tədbirləri.* ◻ **Mühafizə etmək** – 1) pis təsirdən qorumaq, zərərli şeydən hifz etmək. *Bir millət digər millətə üstünlük etmənin qabağını saxlamaq üçündür. Elə isə biz nə üçün öz millətimizi ataq, öz millətimizi mühafizə etmək uğrunda öhdəmizə düşən vəzifəni ifa etməkdə qüsurluq göstərək?* A.Səhhət; 2) xarab olmaqdan, sınmaqdan, dağılmaqdan qorumaq, saxlamaq. *Mexanik maşını mühafizə etmək fikrinə düşmüşdü.* H.Nəzərli.

**MÜHAFİZƏÇİ** *is.* 1. Qoruyan, mühafizə edən, qoruyucu.

2. Keşik çəkən; keşikçi, qoruqçu. *..Hücrənin ətrafında yüz nəfərə qədər sivil paltarında mühafizəçilər gəzirdi.* M.S.Ordubadi.

**MÜHAFİZƏEDİCİ** *sif.* Mühafizə edən, qoruyan; qoruyucu. *Mühafizəedici qurğu.*

**MÜHAFİZƏKAR** *is.* [*ər.* mühafizə və *fars.* ...kar] 1. Vaxtı keçmiş, köhnə qaydaları, adət və ənənələri sevən, onlara riayət edən adam, köhnəlik tərəfdarı; köhnəpərəst. [Yaşlı kişi:] [Tacir] *dinçi və mühafizəkar idi, "sübhanallah" zikri dilindən düşməzdi.* S.Hüseyn. *Atası bir az mühafizəkar və pulpərəstdir.* Ə.Vəliyev. // Sif. mənasında. *Mühafizəkar qoca. – Şərəfzadə mühafizəkar .. bir adamdır.* S.Hüseyn.

2. Mühafizəkar siyasi partiyanın üzvü. [Osmanlıda] *hürriyyətpərəstlər ilə mühafizəkarlar arasında bəzi ictimai fəsadlar vüquə gəlməkdədir.* F.Köçərli.

**MÜHAFİZƏKARLIQ** *is.* Köhnəlik tərəfdarı olma; köhnəpərəstlik. [Hidayət Sənubərə:] *Bu qədər mühafizəkarlıq, etinasızlıq olmaz!* B.Bayramov.

**MÜHAFİZƏT** [*ər.*] *köhn.* bax **mühafizə**. *..Nə qədər ki millət, dil və vətən yolunda fəda olmağa biz qadirik, .. dilimizi və vətənimizi mühafizət edə biləcəyik.* C.Məmmədquluzadə.

**MÜHAKİMƏ** *is.* [*ər.*] 1. Bir şey haqqında fikir, mülahizə, nöqteyi-nəzər. *Camaat, şükür Allaha, öz fikriniz, mühakiməniz var.* C.Məmmədquluzadə. □ **Mühakimə yürütmək** – müəyyən fikir yeritmək, fikir söyləmək, mülahizə yürütmək. [Surxay] *öz dostuna qarşı ittihamkar mühakimələr yürüdürdü.* İ.Əfəndiyev.

2. *hüq.* Məhkəmədə işə baxma. *Mühakimənin gedişi. – Eyni zamanda iki otaqda mühakimə gedirdi.* Mir Cəlal. □ **Mühakimə etmək (eləmək)** – məhkəmədə işinə baxmaq. [Muxtar Firəngizə:] *Bağışlanmaz bir canini mühakimə edərkən belə təqsirnaməsini ondan gizlətmirlər.* B.Bayramov. **Mühakimə olunmaq** – məhkəmədə işinə baxılmaq. *Cani mühakimə olundu. – Qanun üzrə mühakimə olundu; Fərman çıxdı, asılsın, hökm oxundu.* A.Səhhət. *Hümmətgilin bu gün kənddə mühakimə olunacağı xəbəri bircə saatın ərzində bütün el-obaya yayıldı.* B.Bayramov.

**MÜHARİBƏ** *is.* [*ər.*] Dövlətlər arasında mütəşəkkil silahlı mübarizə; hərb, dava. *Birinci dünya müharibəsi. Müharibə vəziyyətində olmaq. – Atabəy məmləkətləri müharibə ərəfəsində idi.* M.S.Ordubadi. *Qanlı müharibələrin şahidi olan İçərişəhər hər yandan qalın barı və bürclərlə əhatə edilmişdi.* A.Şaiq. ◊ **Vətəndaş müharibəsi** – bax **vətəndaş**. **Soyuq müharibə** – bax **soyuq**.

**MÜHASİB** *is.* [*ər.*] bax **buxalter**. *Mühasib əlindəki haqq-hesabı başa çatdırmağa çalışırdı.* S.Rəhimov. *Mən on iki il baş mühasib olmuşam.* İ.Əfəndiyev.

**MÜHASİBAT** *is.* [*ər.* "mühasib" söz. cəmi] bax **buxalteriya**. *Mühasibatı yoxlayaq.* // Mühasiblik. *Sonra Qələndərovu şəhər mühasibat kurslarına göndərdilər.* Mir Cəlal.

**MÜHASİBLİK** bax **buxalterlik** 2-ci mənada. *Mühasiblik kursu.*

**MÜHASİRƏ** *is.* [*ər.*] Hər tərəfdən əhatə olunma, araya alınma; dövrələmə. *Düşmənin mühasirəsini yarmaq. Mühasirədən çıxmaq.* □ **Mühasirə etmək** – hər tərəfdən əhatə etmək, dövrələmək, araya alıb başqaları ilə əlaqəsini kəsmək. *Hadisədən yarım saat keçmədən Atabəy sarayını Azərbaycan qoşunları mühasirə etdi.* M.S.Ordubadi. *Düşmənlər duyuq düşüb aldılar üstümüzü; Etdilər mühasirə dörd yandan kəndimizi.* S.Rüstəm. **Mühasirəyə almaq** – bax **mühasirə etmək**. *Düşmən qoşununu mühasirəyə almaq.* – [Tərlan:] *Bilmirəm haradasa almanlar bizim üç alayı mühasirəyə alıb top atəşinə tutmuşdular.* H.Seyidbəyli.

**MÜHAZİRƏ** *is.* [*ər.*] Ali məktəbdə hər hansı bir fənnin professor və ya müəllim tərəfindən şifahi şərhi; leksiya. *Mühazirəyə qulaq asmaq. Azərbaycan ədəbiyyatı tarixindən mühazirə.* // Hər hansı bir mövzuya dair açıq leksiya. [Musanın nəvəsi] *klublardakı ədəbi mühazirələrin heç birini nəzərdən qaçırmaz.* Qantəmir. [Aydın:] *Mədəniyyət sarayında mühazirə oxunacaq.* Z.Xəlil.

**MÜHAZİRƏÇİ** *is.* Mühazirə oxuyan adam; lektor. *Mühazirəçiyə sual vermək.*

**MÜHƏQQƏQ** *sif.* [*ər.*] *köhn.* Təhqiq olunmuş, doğruluğu və gerçəkliyi məlum olmuş: doğru, gerçək, həqiqi, yəqin, səhih. *Bu nəzəriyyə arvadlar məclislərində çox danışıldıqdan sonra mühəqqəq bir surət aldı.* Ə.Haqverdiyev. [Şəmsiyyə Səlim bəyə:] *Ağam məni sizə sata bilər, bəli, mühəqqəqdir, – o məni sata da bilər, zorla da izdivaca məcbur edə bilər.* M.İbrahimov. // Şübhəsiz.

**MÜHƏNDİS** *is.* [*ər.*] Texnikanın hər hansı sahəsində ali təhsil almış mütəxəssis. *Neft mühəndisi. Hərbi mühəndis. Mühəndis-mexanik. Mühəndis-energetik.*

**MÜHƏNDİSLİK** *is.* 1. Mühəndis sənəti, ixtisası. [Haqverdizadənin] *hər bir yoldaşı özünə ixtisas seçən zaman, o da yol mühəndisliyini bəyənmişdi.* S.Rəhimov.

2. Mühəndis sənəti ilə bağlı olan. *Mühəndislik fakültəsi. – Fərhaddan kağız gəldi ki, mühəndislik diplomunu almışdır, mayın 12-də gəlir.* C.Cabbarlı.

**MÜHƏRRİK** [*ər.*] Hər hansı enerjini mexaniki enerjiyə çevirən maşın, bir şeyi hərəkətə gətirən maşın, motor. *Buxar mühərriki. Daxili yanacaq mühərriki.*

**MÜHƏRRİR** *is.* [*ər.*] 1. Jurnalist. [Şərif:] *Müxbir olsun, mühərrir olsun, şeir yaza bilməsin!* C.Cabbarlı. "*Əkinçi*"*nin mühərrirləri mövhumat və cəhalət əleyhinə mübarizəni çox düşünülmüş və ağıllı şəkildə aparırdılar.* M.İbrahimov. // Müəllif, yazan. *Dəftərin bir neçə səhifəsi cırılmış olduğundan mühərririn adını, təəssüf ki, bəlli edə bilmədim.* T.Ş.Simurq.

2. Redaktor. *Doğrudur, mühərrir belə yazını çap etməyəcəkdir.* S.Vəliyev.

**MÜHƏRRİRLİK** *is.* Mühərririn işi, peşəsi; jurnalistlik, jurnalistika. *Mühərrirlik sənəti Azərbaycanda Həsənbəy Zərdabi ilə başlanır.*

**MÜHƏVVƏL** [*ər.*]: **mühəvvəl eləmək (etmək)** – üzərinə qoymaq, tapşırmaq. *İşi mühəvvəl etmək.*

**MÜHƏYYA** *sif.* [*ər.*] Mövcud olan, hazır olan; mövcud, hazır. *Böyük şəhərdə .. dünyanın hər bir neməti, yeməli və içməli qəbilindən .. həməvaxt şəhər əhli üçün mühəyyadır.* C.Məmmədquluzadə. ◻ **Mühəyya etmək (qılmaq)** – hazır etmək, hazırlamaq. [Rəiyyət] *bizə .. lazım olan mayehtacı mühəyya qıldıqları kimi biz də əvəzində borcluyuq ki, bunlara .. qulluq edək.* F.Köçərli. [Pəri:] *Anam .. lazımi şeylərin hamısını mühəyya edib, toy bu günlərdə başlanasıdır.* C.Cabbarlı. **Mühəyya olmaq** – hazır olmaq, hazırlanmaq. [Turxan bəy Marala:] *Canın nə istərsə, qəlbindən nə keçirsə, bir an içində mühəyya olur, mələkim!* H.Cavid. **Mühəyya olunmaq** – hazır edilmək, hazırlanmaq. [Nəçərnik] *dilcavabı hökm eləmişdi ki, .. məktəbdən ötrü səmtli dam mühəyya olunsun.* C.Məmmədquluzadə.

**MÜHİB** *sif.* [*ər.*] *köhn.* 1. Qorxunc, qorxulu, təhlükəli. *Nəinki uşaqlar ondan* [Haqq Mövcuddan] *qorxurdular, hətta böyük adamlar da onun mühib qiyafəsindən çəkinirdilər.* Ə.Haqverdiyev. *Təpəsi sanki parlayan almaz; Uca, tərpənməyən, mühib Qafqaz.* A.Səhhət.

2. Görünüşcə yekə, iri.

**MÜHİT** *is.* [*ər.*] 1. Hər hansı boşluğu dolduran və müəyyən xassələrə malik olan maddə, cisimlər. *Hava mühiti.*

2. İçərisində hər hansı bir orqanizmin fəaliyyəti cərəyan edən təbii və ya ictimai şəraitin məcmusu. *Coğrafi mühit.*

3. *məc.* İnsanın yaşadığı ictimai məişət şəraiti, habelə bu şərait ümumiliyi ilə bağlı olan adamlar. [Qoca Baxşı:] *Sən illər boyu mühitimizi boğub üzən çürük fikirlərdən, acı dillərdən qorxursan.* C.Cabbarlı. *İnanırdım ki, Sarıköynək Bakı mühitinə tez alışar.* S.Hüseyn.

**MÜHÜM** *sif.* [*ər.*] 1. Vacib, lazımlı. *Mühüm iş. – Həsəni yenə fikir götürdü: yataq pulunun tədarükü mühüm bir məsələ olaraq qarşısında durdu.* Çəmənzəminli. *İki saat əvvəl başlanmış bu iclasda çox mühüm məsələlər müzakirə olunmuş*(*du*). Ə.Vəliyev.

2. Xüsusi əhəmiyyəti olan, xüsusi diqqət verilməli olan; əhəmiyyətli. *Mühüm sənəd. Mühüm məsələ. Mühüm kəşf. – Biz də bu gecə mühüm bir hadisənin zəminəsini qoymalıyıq.* M.S.Ordubadi. *Sabahkı vuruşma qəti və mühümdür.* H.Nəzərli.

**MÜHÜMLÜK** *is.* Xüsusi əhəmiyyəti olma; lazımlıq, vaciblik. *Məsələnin mühümlüyü. Məlumatın mühümlüyü.*

**MÜXABİRƏ** *is.* [*ər.*] *köhn.* Xəbərləşmə, yazışma.

**MÜXALİF**[1] *is.* [*ər.*] Zidd, əks, qarşı, əleyhinə olan. [Mehriban] *bu qəbahəti əxlaqa müxalif bildiyi üçün Səlimə yaxın düşməkdən qorxur.* S.Hüseyn. // Düşmən, əleyhdar, rəqib. *Müxaliflərimizin həmlələrini dəf etmək və ya onlara həmləvər olmaq üçün sədaqət və doğruluqdan başqa bir silahımız yoxdur.* M.İbrahimov. ◻ **Müxalif olmaq** – zidd olmaq, əleyhinə olmaq, əksinə olmaq.

**MÜXALİF**[2] *is.* [*ər.*] *mus.* Klassik Azərbaycan muğamlarından birinin adı. *Müxalif təsnifi. Müxalif oxumaq.*

**MÜXALİFƏT** *is.* [*ər.*] 1. Zidd olma, əks olma, əksinə getmə, müqavimət göstərmə, qarşı durma. ◻ **Müxalifət etmək** – əks olmaq, ziddinə getmək, qarşı durmaq, müqavimət göstərmək. *Çünki Fərəc xan Bağır xanın əmisi oğlu və damadıdır, heç bir əmrdə onun rəyinə müxalifət etməz.* M.F.Axundzadə. *Ancaq mən də* [Eldarın] *söhbəti dəyişmək arzusuna müxalifət etmək istəmədim.* M.Rzaquluzadə.

2. Hər hansı bir cəmiyyət, təşkilat və s. daxilində öz fikrini, siyasətini əksəriyyətin

fikrinə, siyasətinə qarşı qoyan dəstə, qrup. *Müxalifət təşkil etmək. Müxalifətin sualına cavab vermək. Müxalifətin təklifini səsə qoymaq.*

**MÜXALİFƏTÇİ** *is.* və *sif.* 1. Müxalifət edən, qarşı duran, zidd çıxan, əks gedən. *Mövhumat, mərsiyə və mədhiyyə ədəbiyyatına qarşı düzələn müxalifətçi qrupların fikrini nəşr edən şairlər öz şeirlərində mühiti tənqid etməyə başlayırlar.* M.S.Ordubadi.

2. Müxalifətdə olan adam, qrup, partiya və s. (b a x **müxalifət** 2-ci mənada). *Müxalifətçilərin mübarizəsi.*

**MÜXALİFƏTÇİLİK** *is.* Hər hansı fikrə, siyasətə əks getmə, zidd olma, qarşı durma.

**MÜXATƏB** *is.* [*ər.*] Söz söylənilən şəxs, sözlə müraciət olunan adam; dinləyən. *Müxatəbinin sözünü yarımçıq qoymaq, münasibətli-münasibətsiz danışmaq bunun köhnə adətidir.* Qantəmir. *Xəlil acıqlananda həmişə müxatəbinin üzünə yox, yerə baxardı.* M.Hüseyn.

**MÜXATİB** *is.* [*ər.*] Birinə sözlə müraciət edən, söz söyləyən şəxs; söyləyən. *Cuma arxası üstə uzandığı halda əlləri başının altında dönüb müxatibinə baxmadan saymazyana dedi..* Ə.Əbülhəsən. *Qorxmaz müxatibinin üzünə baxanda Saleh başladı..* Ə.Vəliyev.

**MÜXBİR** [*ər.*] 1. *is.* Yerlərdən xəbər yığıb göndərən qəzet, jurnal, radio, televiziya və başqa məlumat orqanı işçisi. *Hərbi müxbir. Xüsusi müxbir. – Oxuculardan təvəqqə edirəm ki, müxbirimiz Mozalanbəyin Ordubad və Əylis barəsində yazdığı sözlərə bir qədər əhəmiyyət versinlər.* C.Məmmədquluzadə. [Şərif:] *Müxbir olsun, mühərrir olsun, şeir yaza bilməsin!* C.Cabbarlı.

2. *sif. köhn.* Xəbəri olan, xəbərdar, baxəbər. [Cahangir bəy:] *Əhvalatdan müxbirəm, ərizələr sabah hazır olar.* N.Vəzirov. [Mehrəli bəy:] *Görünür, əhvalatdan müxbir deyilsiniz.* S.S.Axundov. ◻ **Müxbir etmək** *köhn.* – hadisəni demək, bildirmək, haqqında məlumat vermək, xəbərdar etmək. *Çox danışıqdan sonra* [Usta Ağabala] *arvadını işdən müxbir etdi.* Çəmənzəminli. **Müxbir olmaq** *köhn.* – xəbərdar olmaq. *Əhli-şəhər Hacı Xəlilin vəfatından müxbir olub cəm oldular onun evinə.* Ə.Haqverdiyev. [Rəşid:] *Dərhal Qurbanqulu əhvalatdan müxbir olub, ərizəni şəhərə aparıb vəkillərə verməyi öhdəsinə götürdü.* T.Ş.Simurq.

**MÜXBİRLİK** *is.* 1. Müxbirin işi, vəzifəsi. *Müxbirlik həvəsi məni rahat qoymadı.* B.Bayramov.

2. Xəbərdarlıq, məlumatı olma, xəbərdar olma.

**MÜXƏLLƏFAT** *is.* [*ər.* "müxəlləf" söz. cəmi] Ev şeyləri, ev avadanlığı. [Oğlanın atasından qalma] .. *mis qab-qacaqları və ev müxəlləfatı var imiş.* S.Hüseyn.

**MÜXƏMMƏS** *is.* [*ər.*] *ədəb.* Hər biri beş misradan ibarət klassik şeir forması; beşlik. *Vaqifin "Görmədim" rədifli müxəmməsi. – Gəl danışma müxəmməsdən, qəzəldən; Şeri-həqiqətdən, mədhi-gözəldən.* M.V.Vidadi. *Nə qədər söyləsəm sənin şanına; Yaraşar müxəmməs, qəzəl, sevdigim!* M.P.Vaqif.

**MÜXƏNNƏS** *sif.* və *is.* [*ər.*] Alçaq, namərd, qorxaq. *İgid ölər, adı qalar, müxənnəsin nəyi qalar?* (Ata. sözü). *Müxənnəsdir qorxan bir qaşıq qandan.* Q.Zakir. *Ələsgər, mətləbin tanrıdan istə; Kərəm olmaz müxənnəsdən, xəsisdən.* Aşıq Ələsgər.

**MÜXƏNNƏSLİK** *is.* Alçaqlıq, namərdlik, qorxaqlıq.

**MÜXƏNNƏT** [*ər.* "müxənnəs"dən] b a x **müxənnəs**. *Mərd igidlər müxənnətdən seçilsin; Qarı düşmən dərələrə tökülsün.* "Koroğlu".

**MÜXTƏLİF** *sif.* [*ər.*] Bir cür olmayan, cürbəcür, növbənöv, növ-növ, dürlü-dürlü. *Müxtəlif rənglər. Müxtəlif şeylər. – Müxtəlif səslər bir-birinə qarışır.* S.Rəhimov. // Başqa-başqa, ayrı-ayrı, bir-birinə uymayan, bir-biri ilə düz gəlməyən. *Müxtəlif xasiyyətlər. Müxtəlif rəylər. Müxtəlif fikirlər.*

**MÜXTƏLİFCİNSLİ** *sif.* Bir cinsdən olmayan, cinsləri müxtəlif olan, başqa-başqa cinslərdən törəmiş. *Müxtəlifcinsli heyvanlar. Müxtəlifcinsli metallar.*

**MÜXTƏLİFLİK** *is.* Bir cür, bir çeşiddə olmama; başqa-başqalıq, cürbəcürlük. *Adamların görkəmində qəribə bir müxtəliflik vardı.* B.Bayramov.

**MÜXTƏLİFMƏNALI** *sif.* Mənaları müxtəlif olan, cürbəcür məna ifadə edən. *Müxtəlifmənalı sözlər.*

**MÜXTƏLİFNÖVLÜ** *sif.* Müxtəlif növlərdən ibarət olan, cürbəcür olan.

**MÜXTƏLİFÖLÇÜLÜ** *sif.* Ölçüsü müxtəlif olan, cürbəcür ölçüdə olan. *Müxtəlifölçülü borular.*

**MÜXTƏLİFRƏNGLİ** *sif.* Rəngi müxtəlif olan, cürbəcür rəngdə olan; rəngbərəng. *Müxtəlifrəngli çit. Müxtəlifrəngli kart kağızı.*

**MÜXTƏLİFSƏSLİ** *sif.* Səsləri müxtəlif olan, müxtəlif səslər ifadə edən. *Müxtəlifsəsli samitlər.*

**MÜXTƏLİFTƏRƏFLİ** b a x **müxtəlifyanlı**.

**MÜXTƏLİFYANLI** *sif. riyaz.* Müxtəlif yanları olan; müxtəliftərəfli. *Müxtəlifyanlı üçbucaq.*

**MÜXTƏS** *sif.* [*ər.*] *köhn.* Yalnız bir adama və ya bir şeyə mənsub olan.

**MÜXTƏSƏR** *sif.* [*ər.*] 1. Təfsilatsız, yığcam, qısa (*müfəssəl* ziddi). *Müxtəsər məlumat. Müxtəsər məktub.* // Zərf mənasında. *Bir açıq kağız alıb kəndimizə, Molla Cəfər rəfiqimizə müxtəsər yazdım.* C.Məmmədquluzadə. *Cavad öz döyüşçülərini ətrafına toplayaraq müxtəsər bir söhbət apardı.* Ə.Vəliyev. □ **Müxtəsər etmək (eləmək)** – uzatmamaq, qısaltmaq, qısa eləmək, tez qurtarmaq. *Tulani şikayətlər edərdin bizə, Seyyid; Bəs ol şahi görcək nə üçün müxtəsər etdin?* S.Ə.Şirvani. [Molla Kazım:] *Müxtəsər elə, görürsən xalq məəttəldir.* Ə.Haqverdiyev. [Əhməd:] *Bəli, əhvalat uzundur. Mən müxtəsər edirəm.* T.Ş.Simurq.

2. Ucuz, aşağı (qiymət haqqında). [Kənizləri] *qul alanlar çox müxtəsər qiymətə alırlar.* M.S.Ordubadi.

3. *dan.* Təntənəsiz, kiçik, balaca. *Müxtəsər toy. Müxtəsər yığıncaq.*

4. Ara söz məqamında – xülasə, sözün qısası. *Müxtəsər, qarı ayağa durdu.* (Nağıl). *Nə bir namə, nə bir qasid; Heç biri, müxtəsər, gəlməz.* Q.Zakir. *Müxtəsər, biz hər ikimiz Danabaş kəndinin sakiniyik.* C.Məmmədquluzadə. □ **Müxtəsəri-kəlam** *köhn.* – sözün qısası, xülasə, müxtəsər. *Müxtəsəri-kəlam, padşah əhvalatı danışanda əyyar bildi ki, dədəsi budu.* (Nağıl). *Müxtəsəri-kəlam, bir belə ziyadə rəhmli padşahın təhti-əmrində zadəganlıq etmək nəhayət dərəcədə məlaləfza göründü.* M.F.Axundzadə.

◊ **Müxtəsər cümlə** *qram.* – mübtəda və xəbərdən ibarət cümlə.

**MÜXTƏSƏRCƏ** *zərf* Müxtəsər surətdə, yığcam halda; qısaca. *Müxtəsərcə məlumat vermək. Vəziyyətlə müxtəsərcə tanış etmək. – Rüstəm bəy müxtəsərcə olaraq babilik və bəhailik barəsində Əliyə məlumat verdi.* Çəmənzəminli. // Sif. mənasında. *Müxtəsərcə məktub. Müxtəsərcə cavab.*

**MÜXTƏSƏRƏN** *zərf* [*ər.*] Qısaca, yığcam, qısa şəkildə, qısaldılmış halda.

**MÜXTƏSƏRİ** b a x **müxtəsər** 4-cü mənada. *Müxtəsəri, qoyurmusan mən də bu məktəbə gedim?* Ə.Nəzmi. [Şofer:] *Müxtəsəri, canımı dişimə tutub, birtəhər özümü qayığa saldım.* M.Rzaquluzadə.

**MÜXTƏSƏRLƏŞDİRMƏ** "Müxtəsərləşdirmək"dən *f.is.*

**MÜXTƏSƏRLƏŞDİRMƏK** *f.* Müxtəsər etmək, azaltmaq, ixtisar etmək, yığcamlaşdırmaq, qısaltmaq.

**MÜXTƏSƏRLİK** *is.* Müxtəsər şeyin halı; yığcamlıq, qısalıq. *Cavabın müxtəsərliyi.*

**MÜJDƏ** [*fars.*] b a x **muştuluq**. *Məni ol mahliqa yadına salmaz, bilirəm; Gündə bir müjdə ilə aldadır əğyar məni.* S.Ə.Şirvani. [Zeynəb:] *Ayıl, Leylim, ayıl, sənə müjdə gətirmişəm.* Ə.Məmmədxanlı.

**MÜJDƏÇİ** b a x **muştuluqçu**. *Hər kəşfiyyatçı usta bilir ki, yerin təbəqələrinə ilk yolu o açır, ölkəyə veriləcək milyonlarla ton neftin ilk müjdəçisi olur.* Ə.Sadıq.

**MÜJDƏLƏMƏ** "Müjdələmək"dən *f.is.*

**MÜJDƏLƏMƏK** b a x **muştuluqlamaq**. *Cütçü tez gəlib padşahı müjdələdi.* "Nağıl". *Dönə-dönə yoxlayaraq öz qərarını; Müjdələdi qız ustanı günün birində.* Ə.Cəmil.

**MÜJGAN** *is.* [*fars.* "müjə" söz. cəmi] *klas.* Kirpiklər. *Qəmzə xəncərindən, müjgan oxundan; Cigər parə-parə, dil şanələnmiş.* M.V.Vidadi. *Yağıdır müjganın, cadudur gözün; Cəllad kimi qəmzən qəsd edir, ay qız!* M.P.Vaqif.

**MÜKAFAT** *is.* [*ər.*] 1. Birinin hər hansı bir sahədəki xidmətlərini, müvəffəqiyyətini qeyd etmək üçün ona verilən pul və ya başqa qiymətli bəxşiş. *Ümumdünya sülh mükafatı. Respublika mükafatı laureatı.* // İstehsalat normalarını artıqlamasilə yerinə yetirmək,

maya dəyərini aşağı salmaq və s. müqabilində işçiyə əmək haqqından əlavə verilən pul. [Bəhlul:] *Fabrikdə mükafat almayan az qalırdı.* B.Bayramov. *Yoldaş Calalov, bu ay düz beş yüz yetmiş altı manat mükafat almışam.* H.Seyidbəyli.

2. Bir xidmət və ya yaxşılığa qarşı edilən yaxşılıq; əvəz, qarşılıq. *Eylərdi bu suz ilə münacat; Möhnətlərə istəyib mükafat.* Füzuli. *Sən mükafatını insanlığa xidmətdə ara; Əbədi zövqü, təsəllini həqiqətdə ara.* A.Səhhət. *Səba xanım durub Qətibənin əlinə baxırdı. O bu xidmətinə görə Qətibədən mükafat gözləyirdi.* M.S.Ordubadi.

**MÜKAFATLANDIRILMA** "Mükafatlandırılmaq"dan *f.is.*

**MÜKAFATLANDIRILMAQ** *məch.* Mükafat verilmək, mükafatla təltif edilmək. *İşçilər mükafatlandırıldılar.*

**MÜKAFATLANDIRMA** "Mükafatlandırmaq"dan *f.is.*

**MÜKAFATLANDIRMAQ** *f.* Mükafat vermək, mükafatla təltif etmək. *Xidmətlərinə görə mükafatlandırmaq. İkinci dərəcəli diplomla mükafatlandırmaq.*

**MÜKAFATLANMA** "Mükafatlanmaq"dan *f.is.*

**MÜKAFATLANMAQ** *f.* Mükafat almaq, mükafatla təltif olunmaq.

**MÜKALİMƏ** *is.* [*ər.*] İki və ya bir neçə adam arasında gedən danışıq, söz; dialoq. [Dramaturq] *dəqiq və canlı bir dillə, qısa mükalimələrlə danışmalıdır.* C.Cabbarlı. // Ümumiyyətlə, söhbət, danışıq, müsahibə. *Xudayar bəy gördü ki, ata ilə oğlun mükaliməsi çox uzun çəkəcək.* C.Məmmədquluzadə. *Bu mükalimə arasında Kəyan lap qulağının dibində bir neçə güllə partladığını eşitdi.* Ə.Əbülhəsən. ◻ **Mükalimə etmək** – söhbət etmək, danışmaq. [Molla Həmid:] *Bu üç gündə bəniadəm ilə mülaqat və mükalimə etmək və bir tərəfə çıxmaq* [mövlanaya] *mümkün deyil.* M.F.Axundzadə.

**MÜKƏDDƏR** *sif.* [*ər.*] Kədərli, qəmli, qüssəli, məhzun, qəmgin. *Bahar fəsli el şad olur sərasər; Hərgiz məndən özgə yoxdu mükəddər.* Q.Zakir. *..Yalnız başıma oturub dalğın və mükəddər* (z.) *bir halda düşünürdüm.* S.Hüseyn. ◻ **Mükəddər etmək** – kədərləndirmək, qəmləndirmək, məyus etmək. *Lütf eylə, məni mükəddər etmə!* Füzuli. *Əgər məndən sual etsən, bəradər; Olubdur xatirim qəmdən mükəddər.* S.Ə.Şirvani. **Mükəddər qılmaq** *köhn.* – b a x **mükəddər etmək**. *Ta o gündən məni-biyari mükəddər qıldın.* S.Ə.Şirvani.

**MÜKƏDDƏRLİK** *is.* Kədərlilik, qəmginlik, pərişanlıq, məyusluq. [Şiraslanın] *üzgözündən bir məsumluq, bir mükəddərlik yağırdı.* S.Rəhimov.

**MÜKƏLLƏFİYYƏT** *is.* [*ər.*] Dövlət, yaxud cəmiyyət tərəfindən əhali üzərinə qoyulan vəzifə, borc. *Hərbi mükəlləfiyyət. Əmək mükəlləfiyyəti.* // Yerinə yetirilməsi məcburi olan borc; vəzifə.

**MÜKƏLLƏFİYYƏTLİ** *sif.* Mükəlləfiyyəti yerinə yetirməli olan; borclu, vəzifəli. *Hərbi mükəlləfiyyətli.*

**MÜKƏMMƏL** [*ər.*] 1. *sif.* Heç bir qüsuru, kəsiri, nöqsanı olmayan; hər cəhəti dürüst olan; kəm-kəsirsiz, tam. *Mükəmməl avadanlıq. Mükəmməl səhnə əsəri. Mükəmməl dərslik.*

2. *zərf* Hərtərəfli, tam şəkildə, dərindən, bütün, əla. *Şərq fəlsəfəsini mükəmməl bilmək.* – [Vaqif] *təhsilini öz kəndlərində almışdı, azərbaycancanı və farscanı mükəmməl bilirdi..* Çəmənzəminli. *Fizikanı yaxşı bildiyi üçün Məmməd çox asanlıqla, həm də tezcə bu bəhsi də mükəmməl öyrənib mənimsəyərdi.* Ə.Əbülhəsən.

**MÜKƏMMƏLLƏŞDİRİLMƏ** "Mükəmməlləşdirmək"dən *f.is. Avadanlığın mükəmməlləşdirilməsi.*

**MÜKƏMMƏLLƏŞDİRİLMƏK** *məch.* Mükəmməl hala salınmaq, kəsir cəhətləri yox edilmək, daha da yaxşılaşdırılmaq. *İş üsulları mükəmməlləşdirilmişdir.*

**MÜKƏMMƏLLƏŞDİRMƏ** "Mükəmməlləşdirmək"dən *f.is.*

**MÜKƏMMƏLLƏŞDİRMƏK** *f.* Mükəmməl etmək, qüsursuz hala salmaq; nöqsanlarını, kəsir cəhətlərini yox etmək, daha da yaxşılaşdırmaq. *Texnoloji prosesi mükəmməlləşdirmək.*

**MÜKƏMMƏLLƏŞMƏ** "Mükəmməlləşmək"dən *f.is.*

**MÜKƏMMƏLLƏŞMƏK** *f.* Mükəmməl hala düşmək, qüsursuz olmaq, heç bir əyər-əskiyi qalmamaq, daha da yaxşılaşmaq. *İş üsulları gündən-günə mükəmməlləşir. – İndi toxucu dəzgahı da mükəmməlləşir, bununla da işin sürəti və qazanc artır.* Ə.Əbülhəsən.

**MÜKƏMMƏLLİK** *is.* Mükəmməl şeyin hal və keyfiyyəti; kəsirsizlik, qüsursuzluq. *Texnikanın mükəmməlliyi. Tədris prosesinin mükəmməlliyi. – Siniflərin geniş və təmizliyi, laboratoriya və kabinələrin mükəmməlliyi* [səyyahların] *heyrətinə səbəb oldu.* Çəmənzəminli.

**MÜKƏRRƏR** *zərf* və *sif.* [*ər.*] *klas.* Çox dəfə, dəfələrlə, təkrar-təkrar, təkrarən. *Məqalından mükərrər tutilərtək şəkkər istərdim.* M.P.Vaqif. [Nisə xanım:] *..Xan səni öldürməyə bəhanə axtarır və mən bilirəm ki, bu xüsusda vəzirlə mükərrər məşvərət edibdir.* M.F.Axundzadə. *Gördüm bu rübaini mükərrər.* M.Ə.Sabir.

**MÜQABİL** *is.* [*ər.*] 1. Qarşı, qarşı tərəf, üzümüzə baxan tərəf. *Bizim müqabilimizdə bir irəvanlı əyləşmişdi.* C.Məmmədquluzadə. *Otağın üç qapısı var: biri sağdan, biri soldan və biri müqabildən.* Ə.Haqverdiyev. *..Aktyorların avtomobili qadınlar dəstəsi müqabilində dayanmışdı.* S.S.Axundov. // Sif. mənasında. *Müqabil tərəf.*

2. **Müqabilində** şəklində – əvəzində, qarşılıq olaraq, qarşısında. *Dünyada insan üçün ən böyük ləzzət yaxşı ad qoyub getməkdir ki, belə bir adı da ancaq yaxşı əməllərin müqabilində əldə etmək olar.* M.F.Axundzadə. [Məşədi] *gündən-günə qiymətdən düşən kağız pulun müqabilində gündən-günə qiymətə minən dupduru qızıl alırdı.* S.Rəhimov.

**MÜQABİLƏ** *is.* [*ər.*] 1. *klas.* b a x **müqabil**. ◻ **Müqabilə etmək** *köhn.* – qarşı durmaq, müqavimət göstərmək, əleyhinə çıxmaq, mane olmaq. [Qızıl Arslan:] *Biz, hər nə olursa olsun, bütün bu həyasızlıq və alçaqlıqlara qarşı həqiqətlə müqabilə edəcəyik.* M.S.Ordubadi.

2. *din.* Məsciddə hafizlərin əllərində Quran tutanlarla qarşılıqlı Quran oxumaları. [Ümumi ibadətdən] *sonra gedənlər gedər, yerdə qalanlar müqabiləyə* (*Quran mütaliəsinə*) *oturardılar.* H.Sarabski.

**MÜQAVİLƏ** *is.* [*ər.*] 1. Qarşılıqlı təəhhüdlər haqqında yazılı saziş; bağlaşma, müqavilənamə. *Sülh müqaviləsi. Ticarət müqaviləsi.* ◻ **Müqavilə bağlamaq** – qarşılıqlı təəhhüdlər haqqında şərtnamə bağlamaq. *Dostluq və qarşılıqlı yardım haqqında müqavilə bağlamaq.*

2. Əhdnamə, şərtnamə, sözləşmə. *O, işə müdaxilə etdiyi zaman oğlunuzun gələcəyi haqqında sizinlə bağladığımız müqavilə də öz gücünü itirə bilər.* M.S.Ordubadi.

**MÜQAVİLƏNAMƏ** *is.* [*ər.* müqavilə və *fars.* ...namə] b a x **müqavilə**. *Müqavilənamə bağlamaq. Müqavilənamənin şərtləri.*

**MÜQAVİMƏT** *is.* [*ər.*] 1. Zorakı hərəkətə, zorakılığa qarşı durma; hücuma, təzyiqə, təsirə qarşı güc göstərmə. ◻ **Müqavimət göstərmək** – qüvvəyə qarşı dayanmaq, əks-təsir göstərmək, qarşı durmaq. [Polismeyster:] [Mədəndə işləyənlər] *müqavimət göstərirlər, general həzrətləri!* C.Cabbarlı. *Əhali yerindən qalxaraq müqavimət göstərməyə başladı.* P.Makulu. **Müqaviməti sındırmaq (qırmaq)** – qarşıya çıxan qüvvəni rəf etmək, kənar etmək, gücə üstün gəlmək. *Düşmənin müqavimətini sındırmaq.* – [Səlim] *qarlı küləyin müqavimətini qıra-qıra qapını açdı, nazik paltarda, başıaçıq halda eyvana çıxdı.* B.Bayramov.

2. *fiz.* Cismin hər hansı dəyişikliyə, təsirə əks-təsir göstərmə xassəsi, qabiliyyəti. *Elektrik müqaviməti* (*cismin elektrikkeçirmə dərəcəsi*).

**MÜQAVİMƏTLİ** *sif.* Qüvvəyə, hücuma, təzyiqə qarşı duran, möhkəm müqavimət göstərən.

**MÜQAYİSƏ** *is.* [*ər.*] Oxşar və fərqli cəhətlərini, yaxud birinin o birisindən üstünlüyünü müəyyənləşdirmək üçün qarşılaşdırma, tutuşdurma. [Şərəfoğlu Rüstəmə:] *Sən .. özün də bilirsən ki, bu müqayisə heç şeyə dəyməz.* M.İbrahimov. *Ustanın müqayisəsi də qəribə idi: qızılgül və ekskavator təknəsi.* Ə.Sadıq. ◻ **Müqayisə etmək** – oxşar və fərqli cəhətlərini, yaxud bir şeyin o biri şeydən üstünlüyünü müəyyən etmək üçün onları qarşılaşdırmaq, tutuşdurmaq. *Gülşən anası ilə qonşularını, müqayisə etmək istədi.* Ə.Vəliyev.

◊ **Müqayisə dərəcəsi** *qram.* – əşyanın əlamət və ya keyfiyyətinin az və ya çox olduğunu bildirən və sifəti başqa nitq hissələrindən fərqləndirən xüsusiyyət.

**MÜQAYİSƏLİ** *sif.* Müqayisəyə əsaslanan; müxtəlif hadisələri müqayisə etmək, tutuşdurmaq nəticəsində əldə edilən. *Türk dillərinin müqayisəli öyrənilməsi. Müqayisəli dilçilik. Müqayisəli anatomiya. Müqayisəli üsul.* // Müqayisə nəticəsində alınan, müqayisədə əldə edilən. *Müqayisəli cədvəl. Müqayisəli rəqəmlər.*

**MÜQAYİSƏLİ-TARİXİ** *sif.* Hadisələrin tarixi və müqayisəli öyrənilməsinə əsaslanan. *Müqayisəli-tarixi üsul. Müqayisəli-tarixi dilçilik.*

**MÜQAYİSƏSİZ** *sif.* Misilsiz, misli-bərabəri olmayan. *Müqayisəsiz gözəllik.* – ..[Sonanın] *kürəyində oynaşan xurmayı hörükləri müqayisəsiz idi.* B.Bayramov.

**MÜQƏDDƏM** *qoş.* [*ər.*] *köhn.* 1. Qabaq, əvvəl, irəli (vaxta görə). *Üç ay ondan müqəddəm Qori darülmüəllimini bitirmişdim.* C.Məmmədquluzadə.

2. Vacib, daha, irəli, əhəmiyyətli, əfzəl. *Bu iş o işdən müqəddəmdir.*

**MÜQƏDDƏR** *sif.* [*ər.*] *köhn.* 1. Miqdarı müəyyən edilmiş, təyin edilmiş.

2. Söz gəlişindən başa düşülən.

3. İnsanın alnına yazılmış, alın yazısı.

**MÜQƏDDƏRAT** *is.* [*ər.*] 1. Tale. *Uşaqların müqəddəratı ilə əvvəlcədən məşğul olmaq.* – [Fəxrəddin] *Dilşadın müqəddəratı ilə tanış olacağına inanırdı.* M.S.Ordubadi. [Zaman:] *Bu gecə bizim müqəddəratımız həll edilir.* C.Cabbarlı. *Şeir – azadlığım, şeir – həyatım; Ömrüm, səadətim, müqəddəratım!* Şəhriyar.

2. Bir şeyin sonrakı taleyi, gələcəkdə yaşaması və inkişaf etməsi şəraiti, gələcəyi. *İnqilabın müqəddəratı. Azərbaycan ədəbiyyatının müqəddəratı. – İndi məhsulun müqəddəratı əkini vaxtlı-vaxtında suvarmaqdan asılı idi.* Ə.Sadıq. [Bağırxan:] *Yalnız Təbriz əhalisinin deyil, bütün İran azadlığının müqəddəratı ancaq sabahkı müdafiəmizdən asılıdır.* P.Makulu.

**MÜQƏDDƏS** *sif.* [*ər.*] 1. *din.* Allaha aid olan, ilahi, ilahi qüvvəyə malik. *Müqəddəs ruh. Müqəddəs su.* // Dini sitayişlə əlaqədar yer və ya şeylərin adlarının daimi epiteti kimi işlədilir. *Sözüm yoxdur. Xorasan bir müqəddəs yerdir.* Ə.Haqverdiyev. [Adil:] *Elə bilin ki, dünyada ən müqəddəs bir türbəni çirkaba atırdım.* B.Bayramov.

2. Pak, təmiz, eyib və nöqsanlardan biri. // Mənəvi cəhətdən təmiz, saf, ləkəsiz. *Müqəddəs adam. – Mən müqəddəs ata-ana sözünə; Tapmadım bir əvəz olan kəlmə.* A.Səhhət. *Ana müqəddəsdir, ana doğmadır; Ən böyük məhəbbət yalnız ondadır.* S.Vurğun. // *İs. mənasında*. Mömin, dindar. *Bizim köhnəpərəstlərimiz və müqəddəslərimiz görürlər ki, biz hər bir qüvvəmizi məhz məktəb açmağa sərf eləyirik.* C.Məmmədquluzadə.

3. *məc.* Çox əziz, sevimli. *De görək şimdi müqəddəs vətənin; Hansı bir müşkülü asan oldu?* M.Ə.Sabir. *Hər bir vətəndaş Vətənin müqəddəs hüdudlarını göz bəbəyi kimi qoruyur.* M.Rzaquluzadə.

4. *məc.* Nəcib, ülvi, ulu, yüksək, təmiz, pak. *Müqəddəs hiss. – Bir müqəddəs məhəbbət ilə müdam; Vətəni, xanimanı çox sevirəm.* A.Səhhət. *Gah çəkic vurdu əlim, gah da qələm tutdu əlim; Coşdu könlümdə müqəddəs əməlim.* S.Rüstəm. // Yüksək, şərəfli. *Müqəddəs vəzifə. Vətəni müdafiə etmək hər bir vətəndaşın müqəddəs borcudur.* // Toxunulmaz, sarsılmaz. *Müqəddəs kitaba əl basıb həmən; Dedi: – Şəkkim yoxdur, bu kitab haqdır.* B.Vahabzadə.

**MÜQƏDDƏSLİK** *is.* Müqəddəs olma; paklıq, mənəvi saflıq, təmizlik; ülvilik, şərəflilik. *Markiz professorda bir müqəddəslik görüb də onun ətəyindən öpmək istəyirdi.* N.Nərimanov.

**MÜQƏDDİMƏ** *is.* [*ər.*] Hər hansı bir əsərin başlanğıcı, giriş hissəsi. *Kitabın müqəddiməsi. Müqəddiməni oxumaq. Müqəddimə çalındıqdan sonra pərdə qalxır.* – [Məsumə] "*Kəlilə və Dimnə*"nin *müqəddimələrini yenidən oxuyurdu.* B.Bayramov. // Əsil mətləbə keçməzdən əvvəl deyilən sözlər. *İndi mən müqəddiməni qurtarıb, əsil hekayəyə başlayıram.* // Ümumiyyətlə, başlanğıc. *Adi eşq .. övlad törətməyin müqəddiməsidir.* Çəmənzəminli.

**MÜQƏDDİMƏSİZ** *sif.* və *zərf* Müqəddiməsi olmayan, birbaşa başlanan, girişsiz.

*Müqəddiməsiz danışmaq. Müqəddiməsiz əsər. – Həbib isə ürək sözünü müqəddiməsiz deməyə çətinlik çəkdiyindən bu cür başladı.* Ə.Vəliyev.

**MÜQƏLLİD** *is.* [*ər.*] *klas.* Təqlid edən, təqlidçi.

**MÜQƏLLİDLİK** *is.* Təqlidçilik. *Bizim əqidəmizcə bu müqəllidlik və rəftar millətə xəyanət etməkdir.* M.İbrahimov.

**MÜQƏRRƏB** *is.* [*ər.*] *köhn.* Məhrəm, dost, çox yaxın, səmimi yoldaş, sirdaş. [Vəzir:] *Sultan Mahmud Qəznəvi müqərrəblərindən birisinin boynunu öz əli ilə vurdu.* M.F.Axundzadə. *Bəhmən Mirzə üstüncə gələn adamlardan neçə nəfər və müqərrəblərini götürüb, qalanlarını dala qaytarıb üzünü Rusiyaya tərəf çevirdi.* Ə.Haqverdiyev. *..Gecə-gündüz* [yasavul] *qulluğun dərdini çəkir, buna görə də özünü kovxanın canbir qəlb müqərrəbi göstərirdi.* S.Rəhimov.

**MÜQƏSSİR** *sif.* və *is.* [*ər.*] 1. Təqsiri olan, günahı olan; təqsirkar, günahkar. [Balaş:] *Mən müqəssirəm, Sevil!* C.Cabbarlı. *Müqəssirlə üz-üzə gələndə İmran kişinin gözlərindən qəzəb yağırdı.* M.Hüseyn. [Mədəd] *özlüyündə Xanpərini müqəssir bilir, Xanpəri isə onu günahkar hesab edirdi.* Ə.Vəliyev.

2. Qanunən təqsirkar sayılan, təqsiri olan adam; suçlu, cani, cinayətkar. *Müqəssirə cəza kəsmək. Müqəssirin işinə baxmaq. – Müqəssirin boynunun və ayaqlarının zəncirini açdılar.* M.S.Ordubadi. *Müqəssiri gətiriniz, – deyə məhkəmə* [sədri] *əmr etdi.* H.Nəzərli.

◊ **Müqəssir kürsüsü** – məhkəmədə; müqəssirlərin oturduğu yer. *Katib qabaq tərəfdə, müqəssir kürsüsündə, əli silahlılar arasında əyləşmişdir.* S.Rəhimov. **Müqəssir kürsüsündə oturmaq** – məhkəmə məsuliyyətinə cəlb olunmaq, məhkəməyə düşmək, mühakimə olunmaq.

**MÜQƏSSİRCƏSİNƏ** *zərf* Müqəssir kimi; günahkarcasına, təqsirkarcasına. *Aslan dərindən ah çəkib müqəssircəsinə gülümsünür və təkrar uzanır.* S.Vəliyev.

**MÜQƏSSİRLİK** *is.* Müqəssir olma; təqsirkarlıq, günahkarlıq, suçluluq. *Müqəssirliyi üstündən götürülmək.*

**MÜQƏŞŞƏR** *is.* [*ər.*] Qabığı soyulmuş noxud və ya lobya parası; ləpə. *Ətə müqəşşər qatmaq.*

**MÜQƏVVA** *is.* [*ər.*] 1. İçi boşaldılıb qurudulmuş heyvan və ya quş gövdəsi; oyuq. *Heyvan müqəvvası. Quş müqəvvası. – Gülüstan xala balağın dərisinə otdan-samandan təpib, ağacdan qılça qayırıb balağı andıran bir müqəvva düzəltmişdi.* S.Rəhimov.

2. *məc.* Quru, cansız, çox arıq adam haqqında, skelet; bir dəri, bir sümük. [Şeyx Əbuzər:] *Həm seçilməz o, bir müqəvvadan; Ölüdür, köçməmiş bu dünyadan.* H.Cavid. *Quruyub oldular cansız müqəvva; Əqlini itirmiş iki binəva.* H.K.Sanılı. □ **Müqəvva kimi, müqəvvatək** – cansız skelet kimi, quru; bir dəri, bir sümük. *Şeyx Şaban tək qaldı. Bazarda müqəvvatək gəzirdi.* Ə.Haqverdiyev. **Müqəvvaya dönmək** – canı üzülmək, son dərəcə zəifləmək, arıqlamaq, bir dəri, bir sümük qalmaq. *Gövhərtac .. xiffətdən, qüssədən müqəvvaya dönübdür.* Ə.Haqverdiyev.

3. Tikilən paltarı ölçmək və nümayiş etdirmək və s. üçün taxta və ya başqa materialdan düzəldilmiş insan bədəni şəklində fiqur; maneken. // Məc. mənada. [Xəlilov] *Guya biz burada .. müqəvvayıq.* M.İbrahimov. // Quşları hürküdüb qaçırmaq üçün bostanlarda və s.-yə qoyulan insan bədəni şəklində kukla.

**MÜQƏYYƏD** [*ər.*] b a x **muğayat**. [Kərbəlayı Nadirqulu:] *..Kərbəlayı Fatma, balalarımdan müqəyyəd ol!* M.Əliyev.

**MÜQTƏDİR** *sif.* [*ər.*] 1. Qüvvətli, güclü, qüdrətli, qadir olan, iqtidar sahibi. *İndi göstərək ki, biz .. həmişə, nə kimi mübarizə olursa olsun, mübarizədə müqtədir, yaşamağa da müqtədirik.* T.Ş.Simurq.

2. Bacarıqlı, iqtidarlı, əlindən iş gələn, qabiliyyətli, məharətli, bacaran, edə bilən. *Müqtədir usta* (*sənətkar*). *– Sabir! Ey, sən, sevimli şairimiz; Müqtədir, duzlu sözlü Sabirimiz!* A.Səhhət.

**MÜLAHİZƏ** *is.* [*ər.*] Yaxşı düşünülmüş fikir, rəy, nöqteyi-nəzər. *Mən öz mülahizəmi deyirəm, düşündüyümü deyirəm.* C.Cabbarlı. □ **Mülahizə etmək (eləmək)** *köhn.* – nəzərə almaq, nəzərinə çarpmaq, düşünmək. [Aslan:] *Hər kəs də gərək böylə şeyləri mülahizə eləsin və qansın.* İ.Musabəyov. // Görmək, müşahidə etmək, duymaq. *Katib Kosanın sifətində bədbəxtliyi xəbər verən bir*

*əlamət olduğunu mülahizə edərək qorxuya düşdü və yerindən ayağa qalxdı*. S.Rəhimov. // Adətən cəm şəklində. *Fikirdə tutulan planlar, təxminlər, hesablamalar. Taktiki mülahizələrə görə. Pedaqoji mülahizələr.*

**MÜLAQAT** *is.* [*ər.*] *köhn.* Görüşmə, görüşüb danışma, əlaqə saxlama. *Həmçinin səninlə mülaqat da haramdır*. Ə.Haqverdiyev. [Molla Nəcəf:] *..Sən bu dəqiqədən laməzhəbsən. Səninlə mülaqat belə haramdır*. M.Əliyev. ☐ **Mülaqat etmək** – görüşmək, görüşüb danışmaq, əlaqə saxlamaq, yaxınlıq etmək. [Molla Həmid:] *Bu üç gündə bəni-adəm ilə mülaqat və mükalimə etmək və bir tərəfə çıxmaq* [mövlanaya] *mümkün deyil.* M.F.Axundzadə. [Səfi bəy:] *Bir də Çingizlə mülaqat etsəniz, sizinlə başqa cür danışacağam*. S.S.Axundov.

**MÜLAYİM** *sif.* [*ər.*] 1. Yumşaq, həlim. *Mülayim xasiyyətli. Mülayim adam. – Təbiətən mülayim və olduqca sakit bir xasiyyətə malik olan ortancıl bacı Asya orta məktəbi bitirdikdən sonra ərə getmiş*(*di*). Ə.Məmmədxanlı. // Xoş, yumşaq, ürəyəyatan (səs haqqında). *Avazı idi bəsi mülayim; Üslubi dürüst, üsuli qaim.* Füzuli. *Hüseyn çox mülayim və təsiredici səsi olan bu müəllimin danışdıqlarına diqqətlə qulaq asırdı.* S.Rəhman.

2. *coğr.* İsti ilə soyuq arasında olan, nə çox isti, nə çox soyuq; mötədil (iqlim haqqında). *Mülayim hava. – Bu şəhərin qışı canayatan və mülayimdir.* S.Rəhimov. *Bəxtimizdən bir neçə gündür ki, havalar mülayim* (z.) *keçir.* S.Rüstəm.

**MÜLAYİMANƏ** *zərf* [*ər.* mülayim və *fars.* ...anə] b a x **mülayimcəsinə**. *Mülayimanə danışmaq*. – [Rüstəm:] Yox*, Səriyyə, elə də olmaz, lazımdır ki, bir qədər mülayimanə yalvaraq*. C.Cabbarlı.

**MÜLAYİMCƏSİNƏ** *zərf* Mülayimliklə, mehribancasına, mülayimanə, mülayim tərzdə. *Mülayimcəsinə soruşmaq. – Dostum üzr istəyirmiş kimi mülayimcəsinə sözə başladı.* S.Rüstəm.

**MÜLAYİMLƏŞDİRMƏ** "Mülayimləşdirmək"dən *f.is.*

**MÜLAYİMLƏŞDİRMƏK** *f.* Mülayim etmək; mötədilləşdirmək, yumşaltmaq. *Meşələr Göygölün iqlimini mülayimləşdirir.*

**MÜLAYİMLƏŞMƏ** "Mülayimləşmək"dən *f.is.*

**MÜLAYİMLƏŞMƏK** *f.* 1. Mülayim olmaq, yumşalmaq, həlim olmaq. *Xasiyyəti xeyli mülayimləşib*.

2. Mülayim olmaq, mötədilləşmək, yumşalmaq. *Meşə zonaları salındıqdan sonra iqlim getdikcə mülayimləşir*.

**MÜLAYİMLİK** *is.* 1. Yumşaqlıq, həlimlik. [Kamalın] *üzü adi mülayimliyini itirdi, soyuq və əsəbi bir səmimiyyətlə pərdələndi.* C.Cabbarlı.

2. İsti ilə soyuq arasında olma, mötədillik (iqlim haqqında). *İqlimin mülayimliyi.*

3. **Mülayimliklə** şəklində *zərf* – mülayimcəsinə, xoşluqla, mehribanlıqla, həlimanə. *..Ərəstun bir yanı zarafat, bir yanı ciddi danışan qocaya mülayimliklə cavab verdi.* S.Rəhimov. *Aydın mülayimliklə gülümsədi*. H.Seyidbəyli.

**MÜLƏMMƏ** *is.* [*ər.*] *ədəb.* 1. Hər misrası başqa dildə olan şeir. *Füzulinin müləmmələri məşhurdur.*

2. *sif. köhn.* Ala-bula, rəngbərəng.

3. *sif. köhn.* Parlaq, parıldayan.

**MÜLHƏQ** *sif.* [*ər.*] *köhn.* 1. Qatılmış, qatışdırılmış, əlavə edilmiş. *Miladdan 322-332 il qabaq İskəndəri-Rumi tamam İran zəmini təsxir edib yunana mülhəq etdi.* Ə.Haqverdiyev.

2. Asılı, əlaqədar. *Cənabi-həq o bəhri-bigirani-mərhəmətdir kim; Ona mülhəq olan insan şərəfyabi-səadətdir.* M.Ə.Sabir.

**MÜLHİD** *is.* [*ər.*] Allaha, dinə inanmayan; dinsiz, imansız, kafir. // Söyüş məqamında. *Əgər bu mülhid qızı mülhidi bir təhərliklə başımdan rədd edə bilsəydim heç dərdim olmazdı.* B.Talıblı.

**MÜLK** *is.* [*ər.*] *köhn.* 1. Birinə məxsus torpaq sahəsi, malikanə, nəql olunmaz, daşınmaz əmlak. [Hacı Əli:] *Bir belə mülkləri dolandırmaq, əlbəttə, asan iş deyildir*. N.Vəzirov. // Bina, ev. *Həkimin evi .. beşmərtəbəli bir mülkdə idi.* Mir Cəlal. *Hacı Rəcəblinin mülkü bir dağın döşündə tikilmiş, .. bir hektarlıq yeri tuturdu.* Ə.Əbülhəsən. // *məc.* Obrazlı təşbehlərdə işlədilir. *Unudulmaz el yolunda canı qurban olanlar; Vətən mülkü abad yaşar vəfadarı görəndə.* S.Vurğun.

[Sərətan:] *Üstündür hələlik şair Xaqani; Odur söz mülkünün qadir sultanı*. M.Rahim.

2. *klas.* Ölkə, məmləkət. *Sinədən peykanlar çəkmə, dili etmə xərab; Padşahi-adil öz mülkini viran istəməz.* S.Ə.Şirvani. *Xarici mülkündə də hətta gəzib; Çox tühaf insan görürəm, qorxmuram*. M.Ə.Sabir. *Şəki mülkündə, xanım, xandır bu; Adlı-sanlı igid Tərxandır bu.* A.Şaiq.

**MÜLKƏDAR** *is.* [*ər.* mülk və *fars.* ...dar] Torpaq üzərində xüsusi mülkiyyət və onun qalıqları mövcud olan ölkələrdə torpaq sahibi olan zadəgan. *İri mülkədar. Kəndlilərin mülkədarlarla mübarizəsi. – Müsəlman bəyləri və mülkədarları özgə vaxt kəndlərdə rəiyyətdən bəhrə yığmağa məşğul olurlar*. C.Məmmədquluzadə. [Cavanlardan biri:] *Məhv olsun müftəxorlar, mülkədarlar, xanlar, bəylər!* Ə.Vəliyev.

**MÜLKƏDARLIQ** *is.* Xüsusi mülkiyyət hüququ əsasında torpaq sahələrinə malik olma.

**MÜLKİ** *sif.* [*ər.*] 1. Vətəndaşların hüquqi vəziyyətinə aid olan. *Mülki məcəllə. Mülki hüquq.*

2. Qeyri-hərbi, əsgəri olmayan; sivil. *Mülki hava donanması. Mülki geyim. – Bu dəstənin qabağında mülki paltar geyinmiş bir nəfər gəlirdi.* P.Makulu.

**MÜLK-İMARƏT, MÜLK-MAL** *top.* Mülk, ev-eşik, var-dövlət hamısı bir yerdə. *..Əgər mən müsəlman olandan sonra başıma çarşab salıb üzümü örtsəm, gərək dünyadan əl çəkəm və mülk-malımı atam ərimin üstünə*. C.Məmmədquluzadə. *Keçmişdə evlənən oğlandan mülk-mal, başlıq istərdilər*. Mir Cəlal. [Veysin] *bildiyi bircə bu idi ki, bütün ixtiyar, yer, mülk-imarət, var-dövlət hamısı .. fəqir-füqəranın, yoxsulların əlindədir*. Ə.Əbülhəsən.

**MÜLKİYYƏT** *is.* [*ər.*] 1. Birisinə məxsus və onun tam ixtiyarında olan əmlak, şey və s. *Dövlət mülkiyyəti*.

2. Bir adama, bir şeyə mənsubiyyət, aidiyyət; yiyəlik, sahiblik. *Xüsusi mülkiyyət. Torpaq mülkiyyəti. Əmək alətləri üzərində sosialist mülkiyyəti. – Xüsusi mülkiyyətin; Əleyhinə olsam da kökündən; hemoqlobinlər, leykositlər fərdi olmaya bilməz.* R.Rza.

**MÜLKİYYƏTÇİ** *is.* 1. Mülkiyyət sahibi, yiyəsi. *Xırda torpaq mülkiyyətçisi. Xüsusi mülkiyyətçi*.

2. *məc.* Hər hansı bir şeyi təkbaşına mənimsəməyə çalışan adam.

**MÜLKİYYƏTÇİLİK** *is.* Mülkiyyət sahibliyi, yiyəlik, xüsusi mülkiyyətə sahib olma meyli. *Mülkiyyətçiliklə mübarizə.*

**MÜLTƏFİT** *is.* [*ər.*]: **mültəfit olmaq** – nəzərə almaq, fikir vermək, nəzər yetirmək, əhəmiyyət vermək. [Yusif Sərrac:] *Əsla bu əmrə mültəfit olmayıb, öz riyasının halına və paytaxtının rövnəqinə təvəccöh etmir.* M.F.Axundzadə. [Kəblə Rəcəbəli:] *İndi mən bir neçə söz deyim, sən də mültəfit ol*. Ə.Haqverdiyev.

**MÜMANİƏT** *is.* [*ər.*] Mane olma, maneə, əngəl, maneçilik; qarşıdurma, zidd getmə. *Mümaniəti aradan qaldırmaq.* ◻ **Mümaniət etmək (göstərmək)** – mane olmaq, maneçilik göstərmək, əngəl törətmək. *Hər gün sənin hüzuruna mən gəlmək istərəm; Bu əmrdən mümaniət eylər həya məni.* S.Ə.Şirvani. *Zeynal öz qəbahətini düşünərək Səlimin* [otağa] *keçməsinə mümaniət etməmişdi.* S.Hüseyn.

**MÜMANİƏTSİZ** *sif.* və *zərf* Maneəsiz, heç bir mümaniət olmadan, əngəlsiz. *Mümaniətsiz getmək. Mümaniətsiz daxil olmaq.*

**MÜMARİSƏ** *is.* [*ər.*] Bir şeyi (məs.: idman hərəkətlərini, dərs və s.) yaxşı mənimsəmək, öyrənmək üçün təkrar-təkrar edilən məşq, təlim.

**MÜMKÜN** *sif.* [*ər.*] 1. Hər hansı şərait daxilində həyata keçə bilən, ola bilən. [Südabə:] *..İndi deyin görüm, siz kimsiniz? Rica edirəm, mümkünsə bu dəfə həqiqətini deyin.* M.İbrahimov. ◻ **Mümkün deyil** – imkan xaricindədir, ola bilməz. *Artıq onu da, qayınanamı da aldatmaq mümkün deyildi.* M.Hüseyn. *Yox, yox! Bu mümkün deyil; Ətəyindən tök daşı!* B.Vahabzadə. **Mümkün etmək** – imkanı çatmaq, çatdıra bilmək, bacarmaq. [Səttarzadə] *mümkün etdiyi məclisdən qalmır.* Mir Cəlal. **Mümkün qədər** – bacarıldığı qədər, güc çatdığı qədər, imkan daxilində, şərait olduqca. *Fəxrəddin gecə-gündüz, aram olmadan at sürür və mümkün qədər tez Bağdada yetişməyə tələsirdi.* M.S.Ordubadi.

**Mümkün mərtəbə (dərəcə)** – bax **mümkün qədər**. *Saray mümkün mərtəbədə nəşəli döşənmişdir.* Ü.Hacıbəyov. **Mümkün olmaq** – icrası imkan daxilində olmaq, başa gələ bilmək, həyata keçə bilmək. *Hicr atəşin araya dəxi salma, ey rəqib; Mümkün olurmu ayrıla pərvanə nardən?* Natəvan. [Nurəddin:] *Mümkün olsa mənim şəkil dəftərimi və rəng qutumu göndərərsiniz*. S.S.Axundov.

2. Maddi imkan. *Mümkünü yoxdur. Hədiyyə almağa mümkünü var.*

3. Xəbər şəkilçisi ilə: **mümkündür** – imkan daxilindədir, etmək olar, olar. [Sərdar Zaman xan şaha:] *Təsəddüqün olum, hadisənin əlacı mümkündür*. M.F.Axundzadə. *İrəvanda, Naxçıvanda və İran məmləkətində övrət almaq adət deyil, çünki buralarda həmişə və hər cür övrət siğə eləmək mümkündür*. C.Məmmədquluzadə.

**MÜMKÜNAT** *is.* [*ər.* “mümkün” söz. cəmi] bax **mümkün** 2-ci mənada. *Mümkünatı yoxdur*.

**MÜMKÜNLÜK** *is.* Mümkün ola bilmə, imkan daxilində olma.

**MÜMKÜNSÜZ** *sif.* 1. Qeyri-mümkün, mümkünü olmayan.

2. İmkanı olmayan.

**MÜMTAZ** *sif.* [*ər.*] *köhn.* Seçilmiş, başqalarından seçilən; imtiyazlı. *Körpüyə yalnız mümtaz ailələrin üzvləri buraxılırdı.* M.S.Ordubadi.

**MÜNAQİŞƏ** *is.* [*ər.*] Çəkişmə, bəhsləşmə, toqquşma, ciddi ixtilaf. *Münaqişəyə son qoymaq. – Budur yeni münaqişə başlandı; Oturmaq üstə sözləri uzandı.* A.Səhhət.

**MÜNAQİŞƏLİ** *sif.* Münaqişə doğuran; mübahisəli, ixtilaflı. *Münaqişəli məsələ.*

**MÜNAQİŞƏSİZ** *sif.* və *zərf* Münaqişə doğurmayan; ixtilafsız, mübahisəsiz. *Münaqişəsiz məsələ. Müzakirə münaqişəsiz keçdi.*

**MÜNASİB** *sif.* [*ər.*] Uyğun, müvafiq, yaraşan. *Sən kimi nazəninə nazənin işlər münasibdir*. Füzuli. *Çoxdur cahan içrə nazənin dilbər; Özümə münasib yarı istərəm.* Qurbani. [Zeynal:] *Mehriban, özün etiraf edərsən ki, sənin bizdən kənarda qalmağın münasib deyildir*. S.Hüseyn. ◻ **Münasib görmək** – layiq bilmək, müvafiq hesab etmək, yaraşdırmaq. *Qadir .. piyadaların arasında özünün süvari olduğunu münasib görməyib sıçrayaraq atdan düşdü.* Ə.Əbülhəsən. **Münasib olmaq** – uyğun olmaq, müvafiq gəlmək, yaraşmaq, yerində olmaq. [Almaz:] *Çünki bu saat qadın azadlığı yolunda apardığımız mübarizədə qadın sədr daha münasib olar*. C.Cabbarlı.

**MÜNASİBAT** *is.* [*ər.*] Əlaqə, yaxınlıq, münasibət, rabitə. *Aralarındakı münasibat gərginləşmişdir. Onların münasibatında soyuqluq hiss olunur*. – [Firidun] *Şəmsiyyə ilə Səlimin arasında münasibatın nə şəklə düşdüyünü, bir anlaşma əmələ gəlib-gəlmədiyini müəyyən etməyə çalışdı*. M.İbrahimov.

**MÜNASİBƏT** *is.* [*ər.*] 1. İki şey arasındakı nisbət, uyğunluq, müvafiqlik. *Sözü ilə əməli arasında münasibət yoxdur. – Nazlının anasına verdiyi sualı ilə yoxsul daxmalarını belə diqqətlə nəzərdən keçirməsinin arasındakı münasibət Çimnaz arvaddan gizlin qalmadı.* Ə.Əbülhəsən.

2. Qarşılıqlı əlaqə, rabitə, yaxınlıq. *Onunla münasibətimiz yaxşı deyil. Dövlətlər arasındakı münasibət. Əməkdaşların bir-birinə münasibəti. – ..Müsəlman içində əgər birinin bir böyük ilə münasibəti, gediş-gəlişi və dostluğu olmadı, onu saymırlar.* C.Məmmədquluzadə.

3. **Münasibətilə** şəklində *zərf* – görə, ötrü, əlaqədar olaraq. [Cahan:] *Yoldaşlar! Mart ayının səkkizi münasibətilə çağırılmış iclası açıq elan edirəm*. Ə.Haqverdiyev. [Komandir:] *Çaldığın qələbə münasibətilə səni ürəkdən təbrik edirəm.* Ə.Vəliyev.

**MÜNASİBƏTLİ** *sif.* Yerində, məqamında, zamanında olan. *Münasibətli söz. Münasibətli iş.*

**MÜNASİBƏTLİ-MÜNASİBƏTSİZ** *zərf* Yerli-yersiz, lazım gəldi-gəlmədi. *Münasibətli-münasibətsiz çıxış etmək. – Müxatəbinin sözünü yarımçıq qoymaq, münasibətli-münasibətsiz danışmaq bunun köhnə adətidir.* Qantəmir.

**MÜNASİBƏTSİZ** *sif.* Yersiz, məqamsız, qeyri-münasib, uyğunsuz. *Münasibətsiz danışıq. Münasibətsiz hərəkət.*

**MÜNASİBƏTSİZLİK** *is.* Qeyri-münasib, yersiz, uyğunsuz davranış. [Məmur Cavadla Əliyə:] *Rica edirəm, məni bağışlayın, bəlkə münasibətsizlik edirəm.* Çəmənzəminli.

[Səlim] *başqasının evində münasibətsizlik yapmaq istəmədi..* S.Hüseyn.

**MÜNASİBHAL** *sif.* və *zərf* [*ər.*] *köhn.* Münasib, yaraşan, uyğun. *Amma ..* [paylarda] *yengəninki bir az münasibhal olardı.* R.Əfəndiyev.

**MÜNASİBLİK** *is.* Münasib olma, yaraşma, uyğunluq, müvafiqlik.

**MÜNAZİRƏ** *is.* [*ər.*] *köhn.* Mübahisə, müzakirə.

**MÜNBİT** *sif.* [*ər.*] Əkilən bitkini yaxşı yetişdirən, bol məhsul verən; məhsuldar, bərəkətli. *Münbit torpaq.*

**MÜNBİTLİK** *is.* Yaxşı məhsul vermə qabiliyyəti; məhsuldarlıq. *Torpağın münbitliyi.*

**MÜNCƏR** *is.* [*ər.*]: **müncər olmaq** – bitmək, sona çatmaq, tamamlanmaq, nəticələnmək, bir yerə gəlib çatmaq. [Padşah:] *Səidlə söhbətiniz nə yerə müncər oldu?* Ə.Haqverdiyev. *Qonşular bir az söyüşdükdən sonra iş vuruşmağa müncər oldu.* Çəmənzəminli.

**MÜNDƏRİC** *is.* [*ər.*] *köhn.* Dərc olunmuş, çap olunmuş. *Qarelərimizin diqqətini qəzetimizin 198-ci nömrəsində mündəric* "*Şayani-diqqətdür*" *ünvanlı məqaləyə cəlb edir*(*ik*). Ü.Hacıbəyov.

**MÜNDƏRİCAT** *is.* [*ər.* "mündərəcə" söz. cəmi] Kitabın, məcmuənin, əlyazmasının və s.-nin fəsil və başqa tərkib hissələrinin siyahısı. *Kitabın* (*məcmuənin*) *mündəricatı.*

**MÜNDƏRİCATLI** *sif.* Mündəricatı olan. *Mündəricatlı kitab.*

**MÜNDƏRİCƏ** *is.* [*ər.*] 1. B a x **məzmun** 1-ci mənada. *..Təbriz xalqının gələcək vəziyyəti Sərdar Rəşidin çar konsuluna verəcəyi məlumatın mündəricəsindən asılı idi.* M.S.Ordubadi. *Tapdığın məktubu sadə, üslub və mündəricə etibarilə nağılvari yazıldığı üçün bir az gülməli kağızdı.* Ə.Əbülhəsən.

2. B a x **mündəricat**. *Kitabın mündəricəsi.*

**MÜNDƏRİCƏLİ** *sif.* Mündəricəsi olan, məzmunlu. *Zəngin mündəricəli əsər.*

**MÜNDƏRİCƏSİZ** *sif.* Mündəricəsi olmayan, məzmunsuz. *İndiyə kimi Meracın danışığının məntiqsiz, mündəricəsiz* (z.) *olacağını düşünən Bəhram indi onun danışığını dinləməyi qət etdi.* Ə.Vəliyev.

**MÜNƏCCİM** *is.* [*ər.*] *köhn.* 1. Qədim zamanlarda və orta əsrlərdə: Göy cisimlərinin vəziyyət və hərəkətinə əsasən gələcəkdən xəbər vermək iddiasında olan şəxs; astroloq. *Bir gün lələ bütün münəccimləri cəmləyib, tas qurdurub, rəml atdırıb Məlikməmmədin bəxtinə baxdırdı.* (Nağıl). [Cəlaləddin:] *Onda mən cavan münəccim Mirzə Sədranı bir qara xəbərlə padşahın yanına göndərərəm.* A.Şaiq.

2. Astronomun köhnə adı.

**MÜNƏCCİMBAŞI** *is. köhn.* Baş münəccim, baş astroloq. [Münəccimbaşı] *Mirzə Sədrəddin qibleyi-aləmin ziyarətinə müşərrəf olmaq istəyir bir vacib işdən ötrü.* M.F.Axundzadə. [Xacə:] *Qibleyi-aləm, qoca münəccimbaşı Mirzə Cəlaləddin hüzurunuza gəlmək istəyir.* A.Şaiq.

**MÜNƏCCİMLİK** *is.* Münəccimin işi, peşəsi; astroloqluq (b a x **münəccim** 1-ci mənada).

**MÜNƏQQİD** *is.* [*ər.*] Tənqidçi. ..[Araz] *həyatın acı təcrübələrini dərindən tədqiq və təhlil etmiş olan bir münəqqid ..* [kimi] *yanaşaraq hər şeyi incədən-incəyə düşündü.* A.Şaiq. *Mən uşaqlıqdan başlayıb bu günə qədər bütün həyatımı, münəqqidlər demişkən,* "*tənqidi surətdə*" *gözdən keçirtdim.* Mir Cəlal.

**MÜNƏQQİDLİK** *is.* Tənqidçilik.

**MÜNƏVVƏR** *sif.* [*ər.*] 1. İşıqlı, nurlu, parlaq, rövşən. *Cismindir münəvvər, ağü nazikrək; Ol səmən sinəni mərmər eylədi.* M.P.Vaqif.

2. Ziyalı. *Bu dil münəvvər bir adamın düşüncələrini ifadə etməkdən acizdir.* Çəmənzəminli. // İs. mənasında. *Keçən əsrin Azərbaycan münəvvərləri cəmiyyətin bədənini müayinə etdikdə onun pis bir xəstəliyə mübtəla olduğunu gördülər.* M.İbrahimov.

◊ **Münəvvər etmək (eləmək)** – 1) işıqlandırmaq, işıq saçmaq, nurlandırmaq. *Yəqin bil, ölərəm, şəbistanımı; Münəvvər etməsə cəmalın sənin.* Aşıq Mirzə Həsən; 2) *məc.* bəzəmək, bəzək vermək, süsləmək. [Hacı Fərəc:] *And olsun atamın ərvahına, səni mən qızıla, ləlü cavahirə münəvvər edərəm.* N.Vəzirov. **Münəvvər olmaq** – işıqlanmaq, nurlanmaq. *Dəmbədəm şəmi-cəmalından münəvvər olmasa; Ey gözüm nuri, gərəkməz dideyi-rövşən mana.* Füzuli. *Münəvvər olsun aləmlər; Görünsün mahtab, oxqay!* Aşıq Saleh.

**MÜNHƏSİR** *sif.* [*ər.*] *köhn. klas.* Yalnız bir şəxs və ya şeyə həsr edilən, məxsus olan. *Həqqa ki, həmin vücud birdir; Bir zatə vücud münhəsirdir.* Füzuli. *Birinci gecə söhbət Tellinin əri İslamla olan əlaqəsinə münhəsir edilmişdi.* S.Hüseyn.

**MÜNKİR** *sif.* [*ər.*] 1. *köhn.* Danan, inkar edən, etiraf etməyən, qəbul etməyən; Allahı inkar edən, dinsiz, kafir. [Divanbəyi:] *Mən belə münkir adam görməmişəm*. M.F.Axundzadə. □ **Münkir olmaq** – Allahın varlığını inkar etmək, Allahı danmaq. *Kərəmin ömrünü sən verdin zaya; Münkir oldun, üz tutmadın xudaya.* "Əsli və Kərəm".

2. İslam dininə görə guya ölüləri qəbirdə sorğu-suala tutan iki mələkdən biri (digəri: nəkir).

**MÜNSİF** *sif.* [*ər.*] Mübahisəli bir məsələni və ya işi həll etməkdə vasitəçi olan şəxs. *Bizim aramızda münsif tapılsın; And içmişəm, bu gün döyüş olmasın!* "Koroğlu". *Münsif haqqa haqq, batilə batil söyləsəydi; Əlbəttə ki, nahaq söyləyən şəxs utanardı.* M.Ə.Sabir. *Həmişəyev münsif rolunu dərhal götürdü*. B.Bayramov. □ **Münsif olmaq** – hər iki tərəfin mübahisəli məsələsini həll etmək üçün vasitəçi olmaq, miyançılıq etmək, araçılıq etmək. [Atabala:] *Ay adamlar, siz münsif olun, bu quyuya düşüb işləmək olarmı?* A.Şaiq.

◊ **Münsiflər heyəti** – müsabiqələrdə, yarışlarda, sərgilərdə və s.-də mükafat təyin edən mütəxəssislər heyəti; jüri. *Münsiflər heyəti hazırlıq iclasında bu qərara gəlir ki, özfəaliyyət dərnəyi üzvləri işə pis girişməyiblər.* Ə.Vəliyev.

**MÜNSİFLİK** *is.* Münsifin gördüyü iş, münsif olma. [Yalançaq] *yabısını zınqırovlar, ipək qotazlarla bəzər, arada bu baş-o başa çapıb öz yanında guya münsiflik edərdi.* M.Rzaquluzadə.

**MÜNŞİ** *is.* [*ər.*] *köhn.* Yazıçı, ədib. *Rusiyanın ən məşhur ədibi və sevgili münşisi hesab olunan Anton Çexovun bu iyul ayının ikisində vəfat etməsi .. bilxüsus hüznavər bir hadisə olduğu qəzetlərdə dərc olunan fəqərələrdən görünür.* F.Köçərli.

**MÜNTƏXƏB** *is.* və *sif.* [*ər.*] *köhn.* Bir çoxları arasından seçilmiş, bəyənilmiş. *Məhbubimüntəxəb, bir alinəsəb; Qəmzəsində qəzəb, sən saxla, yarəb!* M.P.Vaqif. // Başqaları arasından öz məziyyətləri ilə seçilən, fərqlənən. ..[Q.Zakir və S.Ə.Şirvani] *Azərbaycan şüəra və üdəbasının ən məşhuru və ən müntəxəbi hesab olunur*. F.Köçərli.

**MÜNTƏXƏBAT** *is.* [*ər.* "müntəxəb" söz. cəmi] Müəlliflərin, yazıçıların seçilmiş əsərlərindən və ya onların hissələrindən ibarət dərs vəsaiti. *Ədəbiyyat müntəxəbatı*.

**MÜNTƏZƏM** [*ər.*] 1. *sif.* Düzgün və ardıcıl, sistematik, sistemli, daimi. *Müntəzəm yazışma. – ..Müntəzəm qulluq Tapdığı .. ayağa qaldırdı.* Ə.Əbülhəsən. *Bu sakitlik içində dənizin dalğaları müntəzəm fasilələrlə .. qəribə səslə xarıldayırdı.* M.Rzaquluzadə.

2. *zərf* Düzgün və ardıcıl surətdə, daim, sistematik. *İdmanla müntəzəm məşğul olmaq. – Hər şey kimi pambıq da müntəzəm və qayğılı becərmə tələb edir.* İ.Əfəndiyev. *Bu "səyahətlər" Mehribanın müntəzəm təhsil almasına mane olurdu.* H.Seyidbəyli.

3. B a x **nizami** 2 və 3-cü mənalarda. *Müntəzəm ordu. – Hamımız müntəzəm qoşun kimi sanki bir qala almağa gedirdik.* A.Şaiq.

**MÜNTƏZƏMLİK** *is.* Müntəzəm olma, ardıcıllıq, sistematiklik; müntəzəm şeyin halı. *Vəzn musiqi səslərinin vaxt etibarilə davamında lazımi müntəzəmliyi təmin və təşkil edir.* Ə.Bədəlbəyli.

**MÜNTƏZİR** *sif.* [*ər.*] Gözləyən, intizar içində olan, intizarda qalan. *Mən müntəzirəm verəm rəvacın; Bimar isə eyləyəm əlacın.* Füzuli. *Hərəmxanada cümlə hərəmlər şahın fərmayişi ilə otaqda hazır olub qüdumuna müntəzir idilər.* M.F.Axundzadə. [Hadi lələ:] *Cahangir ağa Cənnətəlinin evində sənin cavabına müntəzirdir*. S.S.Axundov. *Biçarə student xanımın çıxmağına müntəzir* (z.) *mağazanın qabağında gəzinməyə başladı*. Çəmənzəminli. □ **Müntəzir qalmaq** – intizarda qalmaq, nigarançılıqla gözləmək. *Qalan yoldaşlar da tutdular bərə; Qaldılar müntəzir gələn səhərə*. H.K.Sanılı. **Müntəzir olmaq** – nigarançılıqla gözləmək, intizar qalmaq, dayanıb gözləmək. [Odabaşı:] *Hacı Kamyab darvazaya çıxıb xanın gəlməyinə müntəzir oldu*. Ə.Haqverdiyev. **Müntəzir qoymaq** – intizarda saxlamaq, nigaran qoymaq.

**MÜNTƏZİRLİK** *is.* İntizar içində qalma, nigarançılıqla gözləmə, intizarda olma.

**MÜRACİƏT** *is.* [*ər.*] 1. Birinə üz tutub söylənilən söz, çağırış (istər şifahi, istər yazılı). *Xalqa müraciət.*

2. Xahiş, iltimas, rica. *Məhəlli komitə, şöbə müdirinin .. müraciətini bir həftə təxirə uğratmışdısa da, yenə Zeynaldan bir xəbər çıxmamışdı.* S.Hüseyn. ◻ **Müraciət etmək** – 1) üz tutub demək. *..Veys bu dəfə Qadirə müraciət elədi..* Ə.Əbülhəsən. [Müəllim:] *Siz bu alətlə tanışsınızmı? – deyə sinfə müraciət edib soruşdu.* Ə.Sadıq. *Elçinin atası uşaqlara müraciət etdi.* M.Rzaquluzadə; 2) bir şey üçün şifahi və ya yazılı şəkildə birindən xahiş etmək, yaxud yanına getmək. *Həkimə müraciət etmək. Məktubla müraciət etmək.* – [Nemət hakimə:] *Haqqımı müdafiə etmək üçün ədalət qapısına müraciət edirəm.* Çəmənzəminli. *Zeynal ötəyə-bəriyə müraciət edib, sabiq xidmətini geri istəyirdisə də, müvəffəq olmayırdı.* S.Hüseyn.

3. Geri dönmə, qayıtma. ◻ **Müraciət etmək** – 1) dönmək, qayıtmaq. [Yusif] *Usta Xəlilin yanında qırx yaşında ikən sərraclıq sənətini bir il müddətində öyrənib Qəzvinə müraciət etdi.* M.F.Axundzadə; 2) *məc.* tarixi mövzu və s.-dən istifadə etmək, onun haqqında yazmaq. *Keçmişə müraciət etmək.* – “*Vaqif*”*də Səməd Vurğun yaxın keçmişə müraciət edirsə,* “*Fərhad və Şirin*”*də uzaq keçmişə, Nizami poemalarının əks etdirdiyi tarixə müraciət edir.* M.Arif; 3) bir şeyi və ya şəxsi tapmaq üçün bir yerə baş vurmaq.

4. Bax **müraciətnamə**.

**MÜRACİƏTNAMƏ** *is.* [*ər.* müraciət və *fars.* ...namə] Müraciət məzmunlu təbliğat vərəqəsi. *Nümayişə bir gün qalmış fəhlələri nümayişdə iştirak etməyə çağıran böyük bir müraciətnamə çap olundu.* M.M.S.Ordubadi.

**MÜRAFİƏ** *is.* [*ər.*] *köhn.* Məhkəmə prosesi, mühakimə, mühakimə olunma, məhkəmə. [Səkinə xanım:] *Hakimi-şər adam göndərib, mənə xəbər veriblər ki, vəkil tutub mürafiəyə göndərim.* M.F.Axundzadə.

**MÜRASİLƏ** *is.* [*ər.*] *köhn.* Məktublaşma, yazışma, xəbərləşmə. ◻ **Mürasilə etmək** – yazışmaq, məktublaşmaq, xəbərləşmək. [Məhərrəm Salmana:] *Mənim şübhəli adamlarla mürasilə etdiyim barədə pristav cənablarına xəbər verirsənmiş...* H.Nəzərli.

**MÜRCÜM** *is.* Üzdə, boğazın altında, burnun qabağında və ya üstündə olan artıq ət çıxıntısı. *Gülyaz öz ərinin burnundakı mürcümləri, boğazın altında çox adamın seçə bilmədiyi çapığı görür, sıxılırdı.* M.Hüseyn.

**MÜRDƏŞİR** *is.* [*fars.*] Ölüyuyan, yuyucu. *Molla ilə oturub-duran axırda mürdəşir olar.* (Ata. sözü). [Qarı:] *..Mürdəşir Səkinə nağıl eləyirdi ki, Güləndamın gicgahına qan sızılmışdı.* Çəmənzəminli.

◊ **Üzünü mürdəşir yusun!** *dan.* – Allah öldürsün! ölsün! öl! (qarğış ifadəsi). [Fizzə xanım:] *Kadr şöbəsinin müdiri, görüm, üzünü mürdəşir yusun!* Ə.Məmmədxanlı.

**MÜRƏBBE** *is.* [*ər.*] *ədəb.* Dörd misralıq bənd; bu bənd əsasında yazılmış şeir.

**MÜRƏBBƏ** *is.* [*ər.*] Qənd, şəkər şərbətində bişirilmiş meyvə və ya giləmeyvə. *Zoğal mürəbbəsi. Gilas mürəbbəsi. – Bu vaxt bizim qulluqçu iki stəkan çay, bir qab mürəbbə gətirib mizin üstünə qoydu.* T.Ş.Simurq.

**MÜRƏBBƏLİ** *sif.* Mürəbbə qarışıq, mürəbbə ilə, mürəbbəsi olan. *Usta Ramazan ev sahibinin gətirdiyi mürəbbəli çayı içməyib hirsli-hirsli çıxdı.* M.Hüseyn.

**MÜRƏBBƏLİK** *sif.* Mürəbbə bişirməyə yarayan, mürəbbə üçün olan. *Mürəbbəlik meyvə.*

**MÜRƏBBİ** *is.* və *sif.* [*ər.*] Keçmişdə: dövlətli ailələrində uşaqların təlim və tərbiyəsi ilə məşğul olan şəxs; tərbiyəçi, xüsusi müəllim. *Aya görə mən kimi bir qoca mürəbbinin səhvi harada olub?* C.Məmmədquluzadə. // Məktəblərdə tərbiyə işlərinə baxan müəllim. *Əşrəf yoldaşları ilə bərabər salonda dərs hazırlarkən mürəbbi qapımı açaraq,* “*Əşrəf*”*, – deyə çağırdı.* A.Şaiq.

**MÜRƏBBİLİK** *is.* Mürəbbinin vəzifəsi, işi; tərbiyəçilik. *Mürəbbilik etmək. – Çimnaz müəllimlik, mürəbbilik işini sevib getmişdi.* Mir Cəlal.

**MÜRƏBBİYƏ** *is.* [*ər.*] *köhn.* Qadın mürəbbi. *Rzaqulu xanın İran səfərinə məktəb və darülfünun yoldaşlarından maada mürəbbiyəsi olan Mariya xanım da böyük maneələr göstərməkdə idi.* M.S.Ordubadi. *Bir azdan sonra mürəbbiyə təkcə gəlib skamyanın üstündə əyləşdi.* S.S.Axundov.

**MÜRƏBBİYƏLİK** *is.* Mürəbbiyənin vəzifəsi, işi; tərbiyəçilik. *Mürəbbiyəlik etmək.*

**MÜRƏXXƏS** *sif.* [*ər.*] Rüsxət verilmiş, izin almış, azad edilmiş; azad, izinli, rüsxətli (əsasən şəxs sonluqları ilə işlənir). *Elə ki bu əmal tamam oldu, mollabaşı xalqa elan etdi ki, mürəxxəssiniz!* M.F.Axundzadə. [Əliməmməd ağa] *Səfərə bir neçə sual verib: – Mürəxxəssən! – dedi.* Çəmənzəminli. [Pəri cadu:] *Di, mürəxxəssiniz, gedə bilərsiniz.* Ə.Haqverdiyev. ◻ **Mürəxxəs etmək (eləmək)** – çıxıb getməsinə icazə vermək, rüsxət vermək, azad etmək. [Yusif Sərrac] *əfradi-məclisi mürəxxəs etdi, məclis dağıldı.* M.F.Axundzadə. [Mirzə Mustafa:] *İndi məni mürəxxəs elə, gedim.* E.Sultanov. **Mürəxxəs olmaq** – çıxıb getmək, azad olmaq. *Elə ki, məclis qurtardı, hamı darıldı, Cünun da durub paşanın hüzurundan mürəxxəs oldu.* "Koroğlu".

**MÜRƏKKƏB**[1] *sif.* [*ər.*] 1. Bir neçə hissədən, ünsürdən ibarət olan (*sadə* ziddi). *Mürəkkəb cümlə. Mürəkkəb cihaz. Mürəkkəb maddə. – Gənclər maşınla bərabər bu mürəkkəb mexanizmi hərəkətə gətirən cavan oğlanı da diqqətlə seyr edirdilər.* Ə.Sadıq. // İbarət, əmələ gələn, düzəlmiş, təşkil edilmiş. *İraq, Ərəb, Rey qoşunlarından mürəkkəb düşmən ordularına qarşı ancaq Azərbaycanda mövcud olan ordunu qoymaq mümkün idi.* M.S.Ordubadi.

2. Tərkibini təşkil edən hissələrinə, ünsürlərinə, əlaqələrinə, münasibətlərinə görə çox müxtəlif olan; çoxcəhətli. *Mürəkkəb elmi məsələ. Mürəkkəb problemlər.* // Müxtəlif, bəzən də zidd xüsusiyyətləri, cəhətləri özündə birləşdirən (insanın daxili aləmi, hissləri haqqında). *Mürəkkəb xasiyyət. O çox mürəkkəb adamdır.*

3. Quruluşuna, şəklinə, formasına görə çətin başa düşülən; müəmmalı. *Mürəkkəb ornament.*

4. Başa düşülməsi, qavranılması, yerinə yetirilməsi, həlli və s. cəhətdən çətinlik törədən; çətin. *Mürəkkəb sual. Mürəkkəb əməliyyat. – Şirvan şahlığı məsələsi mürəkkəb bir məsələdir.* M.S.Ordubadi.

**MÜRƏKKƏB**[2] *is.* [*ər.*] Yazı yazmağa məxsus rəngli maye – boya. *Qırmızı mürəkkəb. Qara mürəkkəb.* – [Mirzə Səfər] *dörd-beş kərrə qələmi mürəkkəbə batırdıqdan sonra durub otaqda bir-iki baş gəzindi.* Ə.Haqverdiyev. *Uşaq qələm, mürəkkəb və kağız hazırlayıb nə yazacağını gözlədi.* Ə.Vəliyev.

**MÜRƏKKƏBQABI** *is. köhn.* Mürəkkəb tökməyə məxsus qab. *Stolun üstündə mürəkkəbqabı, qələm və balaca bir ayna görünürdü.* S.Rəhman. [Mehdizadə] .. *stola yaxınlaşdı, nə üçünsə mürəkkəbqabının qapağını götürüb yenə də öz yerinə qoydu.* Y.Əzimzadə.

**MÜRƏKKƏBQURUDAN** *is. köhn.* 1. Mürəkkəbi qurutmaq üçün hopdurucu kağız.

2. Altına bu cür kağız çəkilmiş qövsvari alət; press. *Əlyarov .. mərmər mürəkkəbqurudanı əlinə aldı.* M.Hüseyn.

**MÜRƏKKƏBLƏMƏ** "Mürəkkəbləmək"dən *f.is.*

**MÜRƏKKƏBLƏMƏK** *f.* 1. Mürəkkəbə batırmaq, mürəkkəbə boyamaq. *Üst-başını mürəkkəbləmək.*

2. *məc. zar.* Yazmaq. [Səlim Zərnişana:] *Mənim heykəlim, başımın ucalığı balalarımdır, bir də bax bu mürəkkəblədiyim, cızıqladığım kağızlardır.* B.Bayramov.

**MÜRƏKKƏBLƏŞDİRİLMƏ** "Mürəkkəbləşdirilmək"dən *f.is.*

**MÜRƏKKƏBLƏŞDİRİLMƏK** *məch.* Daha da mürəkkəb edilmək, çətinləşdirilmək.

**MÜRƏKKƏBLƏŞDİRMƏ** "Mürəkkəbləşdirmək"dən *f.is.*

**MÜRƏKKƏBLƏŞDİRMƏK** *f.* Daha da mürəkkəb etmək, çətinləşdirmək. *İşi mürəkkəbləşdirmək.*

**MÜRƏKKƏBLƏŞMƏ** "Mürəkkəbləşmək"dən *f.is.*

**MÜRƏKKƏBLƏŞMƏK** *f.* 1. Sadə haldan mürəkkəb hala keçmək, getdikcə mürəkkəb olmaq. *Hidrotexniki qurğular getdikcə mürəkkəbləşir.*

2. Mürəkkəb olmaq, qarışmaq, çətinləşmək, dolaşmaq. *Şiraslanın vəziyyəti yüngülləşməkdən, aydınlaşmaqdansa, daha da çətinləşir və mürəkkəbləşirdi.* S.Rəhimov. *Həyat xeyli mürəkkəbləşmiş, siyasi və məfkurəvi mübarizələr müxtəlif şəkil almış, qızışmışdı.* M.İbrahimov

**MÜRƏKKƏBLİK** *is.* Mürəkkəb şeyin hal və keyfiyyəti. *Məsələnin mürəkkəbliyi.*

**MÜRƏKKƏBSİLƏN** *is.* Mürəkkəb yazısını silmək üçün rezin; pozan. *Hanı mürəkkəbsilən? Sildi, yayıldı ləkə; Onu gizlətsin bəlkə?* M.Dilbazi.

**MÜRƏTTİB** *is.* [*ər.*] *köhn.* Mətbəədə hərf düzən işçi; düzücü. *Mətbəə mürəttibləri.* – *Qoca mürəttib kiçik bir işarəyə bənddi.* M.Hüseyn.

**MÜRƏTTİBLİK** *is.* Mürəttibin işi, peşəsi. *Mürəttiblik etmək.* – [Məsud] *on iki ildir ki, baş mürəttiblik vəzifəsini ifa edirdi.* H.Cavid.

**MÜRGƏNƏ** *is.* Dəmir şeylərin üzərində əmələ gələn pas, cəng. *Borunun mürgənəsini təmizləmək.*

**MÜRGÜ** *is.* Oyaqlıqla yuxululuq arasındakı hal, yarıyuxulu hal. *Quşlar .. küləkli gecənin təlaş dolu mürgüsündən sonra bir an dincəlib sakit oldular.* Ə.Məmmədxanlı. ◻ **Mürgü basmaq (vurmaq, çalmaq, döymək, almaq)** – b a x **mürgüləmək**. *Uşaq mürgü çalır.* – *..Ocağın qırağında qırmızısaqqal bir kişi oturub mürgü döyürdü*. Çəmənzəminli. *Mürgü aldı zindan açarçısını.* R.Rza. *..Cabbar alnını iri yumruqlarına söykəyib oturduğu halda mürgü çalırdı.* B.Bayramov.

**MÜRGÜLƏMƏ** "Mürgüləmək"dən *f.is.*

**MÜRGÜLƏMƏK** *f.* Yarıyuxulu halda olmaq, mürgü basmaq. *Gah vaxt yay fəsli küçə ilə keçən vaxt görürsən ki, Məşədi Molla Həsən başını dayayıb səkinin bucağına mürgüləyir.* C.Məmmədquluzadə. *Qurban da bir tərəfdə oturub mürgüləyirdi.* T.Ş.Simurq.

**MÜRGÜLÜ** *sif.* Yarıyuxulu, yuxulu. *At mürgülü gözlərini Bağıra dikib, qabaq ayağını yerə bir də vurdu*. İ.Məlikzadə.

**MÜRĞ** *is.* [*fars.*] *klas.* Quş. *O şahbaz gözlərini görəndə; Uçar mürği-ruhum, durmaz bədəndə*. Q.Zakir. *Nə ola Abbası yada salalar; Havada mürğlər qanad çalalar.* Aşıq Abbas. ◻ **Mürği-səhər** *klas.* – xoruz. *Mürği-səhəri çəkəndə avaz; Eylərdi bir özgə növhə ağaz.* Füzuli. *Eylə bilirdim ki, dəxi sübh olub; Mürği-səhərtək bir ağız banladım.* M.Ə.Sabir.

**MÜRĞZAR** *is.* [*fars.* mərğzar] *şair.* Çəmənlik, otluq. *Açılsın gülün, nərgisin; Təzə mürğzar ol, yaylaq!* Aşıq Ələsgər. *Sürüb at, olub varidi-mürğzar*. M.Ə.Sabir.

**MÜRİD** *is.* [*ər.*] Keçmişdə: bir müsəlman təriqət şeyxinə və ya mürşidə beyət edərək ondan təriqətin üsul və mərasimlərini öyrənən adam; şagird. *Pirkətanqulu pirinin şeyxi nə qədər öz müridini bəkləsə də, Məmməd gəlib çıxmadı.* E.Sultanov. [Molla Xəlil] *başından dağılan müridlərini yenə öz tərəfinə çəkməli idi*. S.Hüseyn. *Məşədi Məmməd Səmədin sadiq müridlərindən biri idi.* B.Talıblı. // *məc*. Birinə kor-koranə itaət edən adam.

**MÜRİDİZM** *is.* [*rus.* əsli *ər.* mürid və *yun.* ...izm] *tar.* XIX əsrin 2-ci yarısında rus elmi ədəbiyyatında meydana gələn və Şimali Qafqaz dağlılarının 1820-1860-cı illərdə Rusiya imperiyasının müstəmləkəçilik siyasətinə qarşı yönəlmiş milli azadlıq hərəkatının adını bildirən şərti termin. *Müridizm ideologiyası. Müridizmə imamlar və naiblər başçılıq edirdilər. Seyid Nigari müridizm azadlıq hərəkatının öncüllərindən olmuşdur.*

**MÜRİDLİK** *is.* Mürid olma.

**MÜRŞİD** *is.* [*ər.*] Əsil mənası "doğru yol göstərən" olub, keçmişdə təriqətə başçılıq edən şeyxlərə deyilirdi. [Arif:] *Ey mürşidi-pir, inayət eylə; Əylənmə mənimlə sən də böylə...* H.Cavid.

**MÜRŞİDLİK** *is.* Mürşid olma; rəhbərlik.

**MÜRTƏCE** *sif.* [*ər.*] İrticanın xeyrinə iş görən, yenilik və tərəqqi uğrunda mübarizədə köhnəlik və vaxtı keçmiş şeyləri müdafiə edən, ictimai və mədəni tərəqqinin əleyhinə gedən; irticaçı. *Mürtəce ədəbiyyat. Mürtəce siyasət. Mürtəce partiya.* – "*Şərq-Rus*" *həm inqilabi mübarizənin qızışdığı, həm də mürtəce hakim təbəqələrin təzyiqinin artdığı bir zamanda çap edilirdi.* M.İbrahimov.

**MÜRTƏCELİK** *is.* Mürtəce mahiyyətdə olma. *Siyasətdə mürtəcelik*.

**MÜRTƏD** *is.* və *sif.* [*ər.*] 1. Öz dinini (müsəlmanlığı) atmış; Allahsız, dinsiz, imansız, babi. *Məsələn, mənə deyirlər filankəs babidir, yəni mürtəddir.* C.Məmmədquluzadə. [Molla Vəli:] *Mən onu deyə bilərəm ki, o mürtəddir və qanı halaldır*. Ə.Haqverdiyev. // Dönük, xain.

2. *məc.* İnsafsız, zalım, mürüvvətsiz, rəhmsiz. [Möhtəkir:] *Bu mürtədlər camaatın qanını şüşəyə tutacaqlar, camaat korluq çəkəcək.* P.Makulu. // Söyüş məqamında. [Rüstəm bəy Sənəmə:] *A mürtəd balası, danışma, qulluqçusan, otur qulluqçu yerində!* Ü.Hacıbəyov.

[Fatma xanım:] *Səni gücnən saxlayıram, a mürtəd oğlu!* N.Vəzirov.

**MÜRTƏDLİK** *is.* Allahsızlıq, dinsizlik. // Dönüklük, xainlik.

**MÜRTƏKİB** *sif.* [*ər.*] *köhn.* Haram, pis, yaramaz bir işə qoşulan və ya bu cür işlə məşğul olan. *..Kənardan baxan əcnəbilər bizə deyirlər: – ..Mürtəkibdirlər.* C.Məmmədquluzadə. ◻ **Mürtəkib olmaq** – pis, yaramaz bir işə qurşanmaq, yaraşmaz hərəkət etmək. *Böylə əmələ aqil olan mürtəkib olmaz.* M.Ə.Sabir. [Fərhad:] *Yox, sənin nüfuzun altında bu qədər cinayətə mürtəkib olduğum üçün .. intiqamımı səndən alacağam.* C.Cabbarlı. *Axır vaxtlarda o bir pis əmələ də mürtəkib olmuşdu.* S.S.Axundov.

**MÜRUR** *is.* [*ər.*] 1. Keçmə, ötmə, keçib getmə (vaxt, zaman haqqında). ◻ **Mürur etmək** – keçmək, ötmək, keçib getmək. *Zaman bir axar çay kimi axır, illər mürur edirdi.* C.Cabbarlı. *Əfsus, muradımca mürur etmədi dövran; Saldı məni taxtımdan edib zarü pərişan.* Ə.Nəzmi. **Mürur-əyyamla** – gün(lər) keçdikcə. [Vaqif] *mürur-əyyam ilə xanimərhumun ən müqərriblərindən birisi olubdur.* F.Köçərli. **Mürur-zamanla** – zaman keçdikcə, vaxt keçdikcə. *Müruri-zamanla oxlandı, töküldü; Ehramların daşı.* O.Sarıvəlli.

2. "**ilə**" (**-la**) qoşması ilə – tədriclə, yavaş-yavaş, aramla. *Əkin yerini yaxşılandıran vaxtda səy etmək gərək ki, onu sulayan su bir yerdə dayanmayıb mürur ilə axsın.* "Əkinçi". *Amma biz onun mürur ilə elədikləri fədakarlığı ancaq edən vaxt düşünür(ük).* C.Cabbarlı.

**MÜRÜVVƏT** *is.* [*ər.*] Mərd adama və həqiqi insana xas olan yaxşı sifətlər; rəhm, insaf, mərhəmət, insanlıq. *Mürüvvət sahibi.* – *Mürüvvətə əndazə olmaz.* (Ata. sözü). *Yox kimsədə insafü mürüvvət; İblisəmi uymuş bəşəriyyət?!* H.Cavid. *Olmasaydı bizdə, yarəb, bu məhəbbət kaş ki; Ya olaydı bu gözəllərdə mürüvvət kaş ki.* C.Cabbarlı. ◻ **Mürüvvət etmək (eləmək)** – rəhm etmək, mərhəmət göstərmək, insafa gəlmək, insanlıq göstərmək. **Mürüvvətə gəlmək** – b a x **mürüvvət etmək**.

**MÜRÜVVƏTLİ** *sif.* Mürüvvəti olan, insaflı, insaniyyətli. *Mürüvvətli adam.* – [Hatəm:] *Bəs hanı dünyanın elmli, mürüvvətli adamları.* Ə.Əbülhəsən.

**MÜRÜVVƏTSİZ** *sif.* və *is.* İnsafsız, mərhəmətsiz, zülmkar, mürüvvəti olmayan. *Mürüvvətsiz adam.* – [Səttar:] *Bizi mürüvvətsizlər acından qırırdılar.* Ə.Əbülhəsən.

**MÜRÜVVƏTSİZLİK** *is.* İnsafsızlıq, rəhmsizlik, şəfqətsizlik, zalımlıq.

**MÜRVƏR** *is.* Doqquzdonkimilər fəsiləsindən bitki növü.

**MÜSABİQƏ** *is.* [*ər.*] İştirakçıları içərisindən ən yaxşılarını seçib ayırmaq üçün keçirilən yarış; konkurs. "*Qurtuluş*" *jurnalı gənc yazıçılar arasında yaxşı bədii əsər müsabiqəsi elan etmişdi. Cəfər .. bu müsabiqədə də iştirak edəcəkdi.* M.Arif. [Cahangir Reyhana:] *Mən sizin yerinizə olsaydım maketi müsabiqəyə göndərərdim.* İ.Əfəndiyev.

**MÜSADİRƏ** *is.* [*ər.*] Xüsusi şəxslərə, yaxud şirkət, təşkilat, müəssisə və s.-yə məxsus əmlak, pul və s.-nin bütünlüklə və ya qismən dövlətin xeyrinə zorla və əvəzsiz zəbt olunması. ◻ **Müsadirə etmək (eləmək)** – bir şəxsin, yaxud şirkət, təşkilat, müəssisənin əmlak, pul və s.-ni dövlətin xeyrinə zorla və əvəzsiz olaraq zəbt etmək. *..Şəhərə ərzaq gətirənlərin atlarını ordu üçün müsadirə etdilər.* M.S.Ordubadi. // Çap edilmiş bir əsəri satışdan götürmə.

**MÜSAFİR** *is.* [*ər.*] 1. Səfər edən, səfərə gedən; səyahətə çıxan adam; səyahətçi. *Keçdi çox illər, olmadı orda; Bir müsafir gəlib sirab olsun.* A.Səhhət.

2. Mehmanxanalarda, karvansaralarda və s.-də müvəqqəti yaşayan adam. *Tiflisdə İsmailiyyə mehmanxanasının üçüncü nömrəsinə iki nəfər müsafir düşmüşdü.* C.Məmmədquluzadə. *Geniş pilləkənlərlə üzüaşağı müsafirlər düşürdülər.* S.Rəhimov. // Qonaq. *İndi yanımca gəl, yapış əlimdən; Bir Muğan qızına müsafir gedək.* S.Vurğun. *Dostum, sənin yüz kərə olmuşam müsafirin; Durur ayaq izlərim torpağında, daşında.* S.Rüstəm. *Əziz müsafir üçün hərə bir tədarük görmüşdü.* Mir Cəlal. ◻ **Müsafir etmək** – birini qonaq saxlamaq. [Seyyid:] *Xof etmə, bacı, sən mən seyidi müsafir etdin.* S.S.Axundov. **Müsafir otağı** – qonaq otağı. [Ərən:] *Haman qullar xörəkləri müsafir otağına daşımağa başladılar.* Çəmənzəminli.

**MÜSAFİRƏT** *is.* [*ər.*] *köhn.* Səfərdə olma, səyahət.

**MÜSAFİRXANA** *is.* [*ər.* müsafir və *fars.* ...xanə] *köhn.* Mehmanxana, qonaq evi. [Yaşlı kişi:] *Hacı Ramazan tapşırmışdı ki, Hacı Mirzə Babanın müsafirxanasına düşüb orada mənzil tutum*. S.Hüseyn. *Təzə pir gözəl bir səhranın ortasında idi, yaxşı başıqübbəli məscidi, böyük karvansarası, müsafirxanası və qeyri tikililəri var idi*. E.Sultanov.

**MÜSAFİRXANAÇI** *is. köhn.* Mehmanxanaçı, mehmanxana sahibi və ya mehmanxana saxlayan adam.

**MÜSAHİB** *sif.* [*ər.*] 1. Biri ilə söhbət edən, söhbətdə iştirak edən. *..Məşədi Qədir qəsdən "yatmışıq" deyir və gözünü müsahibindən ayırmaq istəmirdi*. T.Ş.Simurq. *Kazım kişi yenə də duruxdu, müsahibinin lap gözünün içinə baxdı*. Mir Cəlal.

2. Həmsöhbət, dost, rəfiq, yoldaş. *Bir neçə müsahibi-vəfadar; Məcnuni-şikəstəyi görüb zar*. Füzuli. *Qoy Sadıqa desinlər lağlağı, amma o kişi ölən günə kimi mənim rəfiqim, müsahibim və həmdəmimdir*. C.Məmmədquluzadə. *O, uzaq ölkələrin bu qərib müsafirinə müsahib və yoldaş olmaq istəyir*. H.Nəzərli.

**MÜSAHİBƏ** *is.* [*ər.*] 1. Bir məsələ haqqında iki və ya bir neçə adam arasında gedən söhbət, danışıq; ümumiyyətlə, söhbət. *Yenə yolumuza başladıq. Bu dəfə müsahibəmiz bir qədər daha səmimiləşmişdi*. S.Hüseyn.

2. Mətbuatda çap edilmək üçün müxbirin ictimaiyyəti maraqlandıran məsələ haqqında hər hansı bir xadimlə söhbəti. *Nazirlə müsahibə. Teatrın direktoru ilə müsahibə*. // Həmin söhbətin məzmununu şərh edən qəzet yazısı. ☐ **Müsahibə almaq** – mətbuatda çap etməkdən ötrü hər hansı bir xadimlə söhbət aparmaq, danışmaq.

**MÜSAHİBƏÇİ** *is.* Müsahibə edən, müsahibə aparan, danışan.

**MÜSAHİBLİK** *is.* Müsahib olma, söhbətdə yoldaşlıq etmə, həmsöhbət olma. *Mənə o vaxt qəzetçi dedilər ki, mən Sadıq ilə müsahibliyə başladım*. C.Məmmədquluzadə.

**MÜSAİD** *sif.* [*ər.*] Uyğun, əlverişli, münasib; bir şeyə imkan verən. *Müsaid şərait. Müsaid vaxt*. – *Qızların əhvali-ruhiyyəsi bu kimi işlərə müsaid deyildir*. A.Şaiq. ☐ **Müsaid olmaq** – əlverişli olmaq, müvafiq olmaq, münasib olmaq, imkan vermək. *Ey Füzuli, əxtəri-bəxtim müsaid olmadı*. Füzuli. [İlyas:] *Vaxt müsaid olduğu zaman hər axşam bu bağçalarda, bu meşələrdə gəzirəm, – dedi*. M.S.Ordubadi. *Əgər şərait müsaid olsa idi,* [Səməddən] *lap böyük siyasət adamı çıxardı*. B.Talıblı.

**MÜSAİDƏ** [*ər.*] 1. *is.* İzin, icazə, rüsxət. *Qapıçı telefon ilə müdirdən müsaidə istəyib səyyahları içəri buraxdı*. Çəmənzəminli. *O, sonra aşağı qatda pəncərəyə yaxın oturmuş bir gəncin müsaidəsini alaraq tez pəncərə önünə keçdi*. A.Şaiq. ☐ **Müsaidə etmək** – b a x **müsaidə vermək**. [Xanım:] *Müsaidə edin, bir məktub yazım, qoyum*. Çəmənzəminli. *Müsaidə etsəydiniz, təcrübə üçün sizi lentə çəkərdik, – dedim*. C.Cabbarlı. **Müsaidə vermək** – izin vermək, icazə, razılıq vermək, rüsxət vermək. *Mən onun davam etməsinə müsaidə vermədim*. Mir Cəlal.

2. **Müsaidənizlə** şəklində *zərf* – icazənizlə, izin versəniz. *Müsaidənizlə bir neçəsini təqdim etmək istəyirəm*. T.Ş.Simurq. [Yaşlı kişi:] *İndi müsaidənizlə mətləb üstünə qayıdaq*. S.Hüseyn.

**MÜSALİHƏ** *is.* [*ər.*] *köhn.* Sülh, barışıq; barışma.

**MÜSAMİRƏ** [*ər.*] b a x **konsert** 1-ci mənada. *Bir gecə istirahət evində müsamirə tərtib edilmişdi*. S.Hüseyn. [Nuriyyə:] *Həmişə məktəb müsamirələrində güldürücü rollar oynardım*. İ.Əfəndiyev. [Zakirov:] *Deyəsən, bu gecə istirahət evində yenə müsamirə var*. Ə.Məmmədxanlı. // Bir şeyə həsr olunmuş axşam tamaşası.

**MÜSAVAT** *is.* [*ər.*] 1. Bərabərlik. *Fəqr ilə ğina əhlinə kim verdi müsavat?* M.Ə.Sabir. *Çikaqo şəhərində beş min qız hökumətə bildirir ki, əgər arvadlara tamam müsavat verilməsə onlar heç bir vaxt ərə getməyəcəklər*. C.Məmmədquluzadə.

2. Birinci dünya müharibəsindən əvvəl Azərbaycanda milli demokratik partiyanın adı. *"Müsavat"ın 1911-ci ildə yazılmış ilk proqramında bütün dünya müsəlmanları birliyə çağırılırdı*.

**MÜSAVİ** *sif.* [*ər.*] Bərabər.

**MÜSAVİLƏŞDİRMƏ** "Müsavilәşdirmәk"-dәn *f.is.*

**MÜSAVİLƏŞDİRMƏK** *f.* Bәrabәrlәşdirmәk, tәnlәşdirmәk.

**MÜSAVİLƏŞMƏ** "Müsavilәşmәk"dәn *f.is.*

**MÜSAVİLƏŞMƏK** *f.* Bәrabәrlәşmәk, tәnlәşmәk.

**MÜSAVİLİK** *is.* Bәrabәrlik, tәnlik; bir bәrabәrdә olma. *..Müxtәlif sәpkili ziyalılar isә "o dünyanı" tamamilә inkar etmәsә dә, hәr iki dünya arasında müәyyәn bir eyniyyәt vә müsavilik yaradır.* M.İbrahimov.

**MÜSBƏT** *sif.* [*әr.*] 1. Razılıq bildirәn, bәyәnilәn, etiraz doğurmayan. *Müsbәt cavab. Müsbәt rәy. Müsbәt qiymәt almaq. Müsbәt xasiyyәtnamә. –* [Aslan] *hiss etdi ki, yaxşı adamların arasındadır, suala müsbәt cavab verdi.* S.Vәliyev. // Zәrf mәnasında. *Mәsәlә müsbәt hәll olundu.*

2. Lazımi keyfiyyәt vә xassәlәrә malik olan, qәbul edilә bilәn, ümidlәri doğruldan; yaxşı. *Müsbәt tәsir. – Sәba xanım başladığı oyunun müsbәt nәticә verәcәyinә ümid bәslәmirdi.* M.S.Ordubadi. // Yaxşı xüsusiyyәtlәri ilә әtrafındakılardan seçilәn, nümunә ola bilәn. *Müsbәt tip. Müsbәt surәt. – Çobanlar vә başqa müsbәt qәhrәmanlar xalqın nümayәndәlәridir.* M.İbrahimov.

3. *riyaz.* Sıfırdan böyük. *Adi әdәdlәri mәnfi әdәdlәrdәn fәrqlәndirmәk üçün onlara müsbәt әdәdlәr adı verilmişdir.* Z.Xәlilov. // Sıfırdan yuxarı olan hava temperaturunu göstәrmәk üçün işlәdilir. *Müsbәt* (+) *15° isti.*

4. *fiz.* Hissәciklәri proton, pozitron vә s.-dәn ibarәt elektrik növünә aid olan. *Müsbәt yük.*

**MÜSBƏTLİK** *is.* Müsbәt şeyin hal vә keyfiyyәti, müsbәt olma.

**MÜSƏDDƏS** *is.* [*әr.*] *әdәb.* Hәr bәndi altı misradan ibarәt klassik şeir forması. *Seyid Əzim Şirvaninin "Zaman ol zaman idi" müsәddәsi.*

**MÜSƏHHİH** *is.* [*әr.*] *köhn.* bax **korrektor**. *Bir rübaidә dörd qәlәt buraxır; Barakallah, bizim müsәhhihlәr.* Ə.Qәmküsar.

**MÜSƏHHİHLİK** *is. köhn.* bax **korrektorluq**. *Hәlәlik müsәhhihlik edәcәksiniz.* M.Hüseyn. *Gecә saat on ikidәn dördә kimi "İşıq" mәtbәәsindә müsәhhihlik vәzifәsi var idi.* Mir Cәlal.

**MÜSƏLLA** *is.* [*әr.*] *din.* 1. Müsәlmanlarda: cәnazә namazı qılmaq üçün mәscid yanında xüsusi yer; namazgah, namaz yeri.

2. Keçmişdә: şiddәtli quraqlıq zamanı açıq yerә toplaşıb elliklә dua edәrәk Allahdan yağış istәmә ayini. ◻ **Müsәllaya çıxmaq** – keçmişdә: elliklә dua edәrәk Allahdan yağış istәmәk. *Çox quraqlıq keçirdi bipayә; Xәlq çıxmışdılar müsәllayә.* A.Sәhhәt. *..Bir para yerlәrdә camaat müsәllaya çıxıb, Allahdan yağış istәyib.* C.Mәmmәdquluzadә. [Ərәn:] *Dәfәlәrlә müsәllaya çıxılırsa da, göydәn yerә bir damla belә düşmür.* Çәmәnzәminli.

**MÜSƏLLƏH** *sif.* [*әr.*] Silahlanmış, silahlı. *Müsәllәh ordu. Müsәllәh dәstә. – Dәrәnin ortasında bir müsәllәh şәxs Salmanın qabağını kәs*(*di*).. Ə.Haqverdiyev. *Bilsin ana torpaq, eşitsin vәtәn; Müsәllәh әsgәrәm mәn dә bu gündәn.* S.Vurğun.

**MÜSƏLMAN** *sif.* [*dan.*] 1. İslam dininә mәnsub adam.

2. *köhn.* "Dindar" mәnasında. *Müsәlman adamdır.*

**MÜSƏLMANCA** *sif.* vә *zәrf* Keçmişdә canlı dildә "azәrbaycanca" mәnasında işlәdilmişdir. "*Könülsüz nikah*"*ı yazan darülmüәllimeynin şagirdlәrindәn Rzayev familiyasında bir şagirddir ki, müsәlmanca oxuyub-yazmağa artıq şövqü var.* F.Köçәrli. *Müsәlmanca bilmirsiniz? Nә söylәyirsiniz, qardaşım.. Ana dilini bilmәmәk... vay, vay, bu olmadı ki!..* N.Vәzirov.

**MÜSƏLMANÇILIQ** *is.* 1. B a x **müsәlmanlıq**.

2. *mәc. dan.* "Gerilik, cәhalәt, nadanlıq" mәnasında. *Bәli, köhnәlik, müsәlmançılıq hәlә bizә az ziyan vermir, – deyә Fәrhadoğlu başını yırğaladı.* S.Rәhimov.

**MÜSƏLMANLIQ** *is.* Müsәlman dininә mәnsub olma. [Dilbәr:] *Siz özünüz xalqı müsәlmanlığa çağırırsınız, bәs şәriәtdә özgә arvadlara baxmaq olarmı?* C.Cabbarlı. // İslamiyyәt. *Müsәlmanlıqda bundan artıq nә tәlәb oluna bilәr?* T.Ş.Simurq.

**MÜSƏLSƏL** *sif.* [*әr.*] *klas.* Zәncir kimi bir-birinә bağlı olan, qırılmaz bir sıra tәşkil edәn, bir silsilә şәklindә olan; sıralanmış. *Hanı o sәn görәn әhmәr yanaqlar; Müsәlsәl keysular, nәsrin buxaqlar?* Q.Zakir.

**MÜSƏMMA** *is.* [*ər.*] *aşp.* Qoyun və ya toyuq ətindən albuxara, kişmiş, qaysı qurusu ilə bişirilən xörək növü. *Firni və tərək, dolma, fisincan da bizimdir; Boşqab da, müsəmmavü badımcan da bizimdir.* M.Ə.Sabir.

**MÜSƏNNİF** *is.* [*ər.*] *köhn.* Müəllif, avtor. [Axund:] *Müsəlmanlar arasında belə bir abdar əşar müsənnifləri nadi-rülvücuddur.* Mir Cəlal.

**MÜSƏVVƏR** *sif.* [*ər.*] *köhn.* 1. Şəkillərlə bəzədilmiş; rəsmli.

2. Rəsm edilmiş, çəkilmiş.

3. Təsəvvür olunan, təsəvvürə gətirilən.

4. Müəyyən bir şəkli, forması olan.

**MÜSİBƏT** *is.* [*ər.*] 1. Bəla, fəlakət, afət. *Müsibətə düşmək. Müsibətdən qurtarmamaq. – Birisinin başına bir müsibət gələndə yenə bir yandan bir qəlb təskinliyi olur*. C.Məmmədquluzadə. [Musa:] *Kişi gərək hər müsibətə mərdanəlik ilə davam eləyə*. Ə.Haqverdiyev. ◻ **Müsibət çəkdirmək** – başına bəla gətirmək, əziyyət vermək, çox incitmək. **Müsibət çəkmək** – başı bəlalar çəkmək, məşəqqət görmək, ağır vəziyyət keçirmək. *Amma çox müsibət çəkib, çox padşahlar öldürüb sonra murada çatarsan.* (Nağıl).

2. Matəm, yas, ölüm hadisəsi, faciə, bədbəxtlik. *Bu müsibətdə, cənab Allah dərgahından sizə səbir, təskinlik diləməkdəyəm.* M.S.Ordubadi. *Qardaşım bu vaxta qədər nə üçün gəlmədi? Başıma gələn qara müsibətdən xəbəri yoxdurmu?* A.Şaiq.

3. **Müsibətlə** şəklində *zərf* – çox böyük çətinliklə, əzab-əziyyətlə, zorla (çox zaman "ənvai-müsibətlə" şəklində işlənir). *Müsibətlə işi görüb qurtarmaq. – Min ənvai-müsibətlə qayaya dırmaşdı.* "Koroğlu". *Kişi ənvai-müsibətlə qapının qıfılını sındırardı və açardı*. H.Sarabski.

**MÜSİBƏTLİ** *sif.* Müsibət içində olan; ağır, fəlakətli, faciəli. *Müsibətli günlər. – İskəndərin kənddən baş alıb getməyinə müsibətli bir qəzavü-qədər bais olmuşdu.* E.Sultanov. *Çox heyf olsun ki, bizimkilər bu cür müsibətli bir gündə öz qarınlarının qeydinə qalıblar.* M.S.Ordubadi.

**MÜSİBƏTZƏDƏ** *sif.* [*ər.* müsibət və *fars.* ...zədə] Müsibətə düşmüş, fəlakətə düçar olmuş, müsibət çəkmiş. *Tutalım ki, digər millətlərə nisbətən sən daha artıq müsibətzədəsən*. M.İbrahimov.

**MÜSİNN** *sif.* [*ər.*] *klas.* Sinli, yaşlı, yaşı ötmüş, qoca. *Müsinn qadın.* – [Qazı Xudayar bəyə:] *Mən indi müsinn adamam, mənim olar səksən və bəlkə dəxi də artıq yaşım.* C.Məmmədquluzadə. [Xortdan:] *Bir nəfər müsinn kişi əl eləyib faytonu dayandırdı.* Ə.Haqverdiyev.

**MÜSLİM** [*ər.*] b a x **müsəlman** 1-ci mənada.

**MÜSTƏBİD** *sif.* və *is.* [*ər.*] 1. İstibdadçı, zalım hökmdar, hakimi-mütləq. *Müstəbidlər yaşamaqçın rahət; Şairi əldə ediblər alət.* A.Səhhət.

2. Zalım, zülmkar, qaniçən. [Atabala] *çox məzlumları zalımların pəncəsindən qurtarmış, çox müstəbidin ocağını söndürüb yelə sovurmuşdu.* A.Şaiq.

**MÜSTƏBİDLİK** *is.* Zalımlıq, zülmkarlıq, qaniçicilik, istibdad.

**MÜSTƏCAB** *sif.* [*ər.*] *din.* Arzusu, istəyi qəbul olunan. ◻ **Müstəcab olmaq** – arzusu, istədiyi qəbula keçmək, xahişi yerinə yetmək, arzusuna çatmaq. [Həmzə bəy:] *Belə ki, duan müstəcab olur, elə dua elə, Nəcəfin pulunu ud.* Ə.Haqverdiyev. *Şırım Ballının duası müstəcab oldu*. Çəmənzəminli.

**MÜSTƏHƏQ** *sif.* [*ər.*] *köhn.* Haqlı olan, haqq qazanmış, layiq, haqlı. *Elm və bilik sahiblərinin yolunda çəkilən zəhmətlər həmişə vacib və müstəhəqdir.* C.Məmmədquluzadə. [Molla:] *Əgər əhvalat belədirsə, onlar hər cəzaya müstəhəqdirlər.* P.Makulu. ◻ **Müstəhəq olmaq** – layiq olmaq, münasib olmaq, haqlı olmaq.

**MÜSTƏİD** *sif.* [*ər.*] İstedadlı, qabiliyyətli, fəhmli, tez görüb-götürən. *Şübhəsiz, bu çox müstəid bir gənc idi*. A.Şaiq.

**MÜSTƏİDLİK** *is.* İstedadlılıq, qabiliyyətlilik.

**MÜSTƏQİL** *sif.* [*ər.*] 1. Başqasından asılı olmayan, başqasına tabe olmayan; sərbəst. *Müstəqil respublika. Müstəqil hökumət.*

2. Özü-özlüyündə əhəmiyyəti olan, başqaları ilə bağlı olmayan, başqalarından ayrılan; ayrıca, xüsusi. *Müstəqil məsələ. Elmin müstəqil sahəsi.*

3. *Zərf mənasında*. Başqasının köməyi və ya rəhbərliyi olmadan, öz bacarığı, təşəbbüsü ilə icra edilən. *Müstəqil iş. Müstəqil fəaliyyət göstərmək. – Biz qarşıdakı məsələni həll etmək üçün az-çox müstəqil hərəkət etməli idik*. H.Nəzərli. *Şamama birinci dəfə idi ki, müstəqil olaraq pambıq becərirdi*. İ.Əfəndiyev. *Aslan onlara ixtisas üzrə bilik verir, müstəqil işləməyə öyrədirdi.* M.Rzaquluzadə. // Kənar təsirlərdən azad; orijinal. *Müstəqil mühakimə*. – [Firəngiz Şahinə:] *Öz müstəqil fikri olan və axıra qədər onu müdafiə eləyən adamlardan xoşum gəlir*. B.Bayramov.

**MÜSTƏQİLLƏN** *zərf* [*ər.*] Müstəqil olaraq, özbaşına, başqasının göstərişi, köməyi, müdaxiləsi olmadan. *Müstəqillən çalışmaq. Məsələni müstəqillən həll etmək.*

**MÜSTƏQİLLİK** *is.* Müstəqil olma halı.

**MÜSTƏQİM** *sif.* [*ər.*] 1. Düz, rast. *Müstəqim yol. Müstəqim xətt.*

2. Birbaşa, bilavasitə, düzünə. *Deputat seçkiləri müstəqimdir.*

**MÜSTƏQİMLİK** *is.* Müstəqim olma, birbaşa olma. *Seçkilərin müstəqimliyi*.

**MÜSTƏMLƏKƏ** *is.* [*ər.*] İmperialist dövləti tərəfindən zorla tutulub istismar edilmiş, siyasi və iqtisadi istiqlaliyyətini itirmiş ölkə.

**MÜSTƏMLƏKƏÇİ** *is.* Müstəmləkəçilik siyasəti yeridən, müstəmləkə xalqlarını istismar edən (b a x **müstəmləkə**). *Müstəmləkəçilərin zülmü. Müstəmləkəçilərə qarşı mübarizə*. // Müstəmləkəsi olan. *Müstəmləkəçi dövlətlər.*

**MÜSTƏMLƏKƏÇİLİK** *is.* İmperialist dövlətlərinin zəif inkişaf etmiş ölkələri iqtisadi və siyasi cəhətdən özlərinə tabe etmə, müstəmləkəyə çevirmə siyasəti. *İmperializmin əsas xüsusiyyətlərindən biri müstəmləkəçilikdir!* A.Şaiq.

**MÜSTƏMLƏKƏLƏŞDİRİLMƏ** "Müstəmləkələşdirilmək"dən *f.is.*

**MÜSTƏMLƏKƏLƏŞDİRİLMƏK** *məch.* Müstəmləkə halına salınmaq, müstəmləkə edilmək.

**MÜSTƏMLƏKƏLƏŞDİRMƏ** "Müstəmləkələşdirmək"dən *f.is.*

**MÜSTƏMLƏKƏLƏŞDİRMƏK** *f.* Müstəmləkə halına salmaq, müstəmləkə etmək.

**MÜSTƏNTİQ** *is.* [*ər.*] İlk məhkəmə istintaqı aparan vəzifəli şəxs; silistçi. *Həmin gündən sonra Cavahir müstəntiqin tələbi üzrə həbs edildi.* T.Ş.Simurq. *Prokuror müstəntiqlə söhbətinə ara verdi*. M.Hüseyn.

**MÜSTƏNTİQLİK** *is.* Müstəntiqin vəzifəsi, işi; silistçilik.

**MÜSTƏSNA** *sif.* [*ər.*] 1. Ümumi qaydalardan, adi normalardan xaric, istisnalıq təşkil edən. *Müstəsna hal. Müstəsna qanunlar*. // *is.* Ümumi qaydadan, adi haldan, normadan kənara çıxma. *Bəzi kəlmələr bu qrammatik qaydadan müstəsnadır.*

2. Başqaları kimi olmayan, başqalarına bənzəməyən, misilsiz, görünməmiş, qeyri-adi. *Müstəsna ustalıq. – Əlikram müstəsna bir məharətlə lazım olanların hamısının damarlarına bələdləşmişdi.* B.Bayramov. // Fövqəladə, özü kimilərdən üstün; qeyri-adi, nadir. *Müstəsna gözəllik. Müstəsna musiqi əsəri. – Öylə müstəsna gözəlsən kim, sənə yoxdur bədəl.* Füzuli.

**MÜSTƏSNALIQ** *is.* İstisna təşkil etmə, yalnız müəyyən şəxsə, müəyyən şeyə, yaxud hadisəyə xas olma. *Şəraitin müstəsnalığı.*

**MÜSTƏVİ** [*ər.*] 1. *sif.* Üstü düz, hamar, hər tərəfi bir cür olan. *Müstəvi səth*.

2. *is. riyaz*. İki ölçüsü olan səth.

**MÜSYÖ** [*fr.*] Cənab, ağa (hörmət əlaməti olaraq fransıza müraciət etdikdə və ya onun haqqında danışıldıqda işlədilirdi). *M.F.Axundzadənin "Müsyö Jordan və Dərviş Məstəli şah" komediyası. – Birinci qəhrəmanımız .. müsyö Qameldir.* Qantəmir.

**MÜŞAHİDƏ** *is.* [*ər.*] 1. Diqqətlə baxma, nəzər yetirmə, seyr etmə. □ **Müşahidə etmək (eləmək)** – 1) diqqətlə baxmaq, göz qoymaq, seyr etmək. *Səidə xanım otağının açıq pəncərəsindən bizi müşahidə eləyirmiş*. M.Hüseyn; 2) görmək, hiss etmək. [Yaşlı kişi:] *Bir neçə saat əvvəl ürəyi xarab olan zaman mən onda qəribə bir hal müşahidə etdim*. S.Hüseyn. ..*Kərəmzadə* [Səlimin] *zəif damarını yamanca dəqiqliklə müşahidə eləmişdi*. B.Bayramov.

2. Diqqətlə baxaraq, araşdıraraq öyrənmə, tədqiq etmə. *Heyvanların həyatı üzərində aparılan müşahidələr. – Zoologiya dərslərində*

*əməli iş və laboratoriya məşğələləri, təcrübə, müşahidə və mikroskopla işləmək çox mühüm yer tutur.* C.Cəbrayılbəyli. *Ziynət analığını işığa saldı, müşahidəsini yazdı.* B.Bayramov. ☐ **Müşahidə aparmaq** – müntəzəm göz qoymaqla, diqqət yetirməklə öyrənmək, tədqiq etmək, araşdırmaq. [Kamil] *qayığı saxlatdırıb xırda ada və daşlarda müşahidə aparır, fotoaparatla şəkil çəkirdi.* M.Süleymanov.

3. Nəzarət etmə, göz qoyma, izləmə. ☐ **Müşahidə məntəqəsi** – düşməni izləmək üçün xüsusi təchiz olunmuş gizli yer. *..Mərmi lap müşahidə məntəqəsini ağzına aldı.* Mir Cəlal. *Müşahidə məntəqəsində növbədə durduğum birinci dəfə deyildir.* Y.Əzimzadə.

4. *məc.* Müşahidə və təcrübə nəticəsində hasil olan dünyagörüşü. *Geniş müşahidəyə malik yazıçı.*

**MÜŞAHİDƏÇİ** *is.* 1. Müşahidə edən, müşahidə aparan, baxan, göz qoyan adam. // Vəzifəsi, ixtisası müşahidə aparmaqdan, nəzarət etməkdən ibarət olan (adam). *Rəsədxana müşahidəçisi. Hərbi müşahidəçi.* // Sif. mənasında. *Müşahidəçi əsgər.*

2. Başqalarının görə bilmədiyi, hiss etmədiyi incəlikləri, nöqtələri görən, duyan adam. *Yaman müşahidəçidir.*

**MÜŞAHİDƏÇİLİK** *is.* Müşahidə etmə, müşahidə aparma. *Cəfər Cabbarlıda hələ uşaqlıqdan müşahidəçilik qabiliyyəti inkişaf etmişdi.* M.Arif.

**MÜŞAVİR** *is.* [*ər.*] Müxtəlif vəzifə sahiblərinin adı. *Hərbi müşavir. Ədliyyə müşaviri.* // Məşvərətçi, məsləhətçi. *Bu, xanın vəziri və dövlətin müşaviri Molla Pənah Vaqif idi.* Çəmənzəminli. *Müşavir doğrudan da* [Ağarzaya] *bir kağız verdi.* Mir Cəlal. *Bu gənc, vəliəhdin müşaviri və Təbriz bəylərbəyisi idi.* P.Makulu.

**MÜŞAVİRƏ** *is.* [*ər.*] 1. Hər hansı bir məsələnin birlikdə müzakirəsi; iclas. *İstehsalat müşavirəsi. Ümumittifaq müşavirəsi. Dilçilik müşavirəsi. – Söhbət qısa və konkret olduğundan müşavirə tez qurtardı.* H.Seyidbəyli.

2. Bir məsələni götür-qoy etmə; məsləhət, məşvərət. [Zeynal] *bu gün özü ilə Mehribanın arasında olan ixtilafı həll .. etmək üçün evində bir müşavirə tərtib etmişdi.* S.Hüseyn.

**MÜŞAVİRƏBAZ** *is.* [*ər.* müşavirə və *fars.* ...baz] Tez-tez müşavirə (iclas) çağırmağı sevən adam; iclasbaz (mənfi mənada işlənir).

**MÜŞAVİRƏBAZLIQ** *is.* Tez-tez müşavirə çağırmaqla məşğul olma; iclasbazlıq (mənfi mənada işlənir). *Get-gedə kolxozçular Xanpərinin müşavirəbazlığını lağa qoymağa başladılar.* Ə.Vəliyev.

**MÜŞAVİRLİK** *is.* Müşavirin vəzifəsi, işi. [Qoca] *özü din xadimi, müfti, vaiz olmaqla qazı yanında müşavirlik də edərdi.* "Qabusnamə".

**MÜŞAYİƏT** *is.* [*ər.*] Yanınca getmə, ötürmə. ☐ **Müşayiət etmək** – 1) ötürmək, yola salmaq. [Mehriban] *keçən gün* [Səlimin] *tövsiyələrini diqqətlə dinləmiş, onu vağzaladək müşayiət belə etmişdi.* S.Hüseyn; 2) bir yerə qədər yanınca getmək, bərabər getmək. *Nümayəndələri müşayiət etmək. – Fabrik müdiri də bizi müşayiət edirdi.* M.İbrahimov; 3) qorumaq, yaxud da yol göstərmək, bələdçilik etmək üçün yanınca getmək. *Generalı müşayiət etmək. – Vəliəhd döyüş səhnəsinə daxil olan kimi onu müşayiət edən iki yüz Gəncə atlıları geri çəkildilər.* M.S.Ordubadi. ...**müşayiəti ilə** – 1) bərabər, bir yerdə, yanınca gedərək. *Qətibə gözəl kənizlər və cariyələrin müşayiəti ilə daxil olub, böyük salonun ortasında dayandı.* M.S.Ordubadi. *Teymur şahidlərin müşayiəti ilə mağazanı gəzməyə başladı.* H.Seyidbəyli; 2) *mus.* oxuyan və ya solo çalanla birgə çıxış edib öz çalğısını onların oxumasına və ya çalmasına uyğunlaşdıraraq. *Nəhayət, Cimi tarın müşayiəti ilə oxumağa başladı.* İ.Əfəndiyev. *Bir salonda tar-kamança müşayiəti ilə oxunan xoş bir el mahnısının səsi gəlir.* M.Rzaquluzadə.

**MÜŞAYİƏTEDİCİ, MÜŞAYİƏTÇİ** *is.* Müşayiət edən, yanınca gedən, ötürən. *Osman ağa da, onun müşayiətçisi də bir-birinə baxdılar.* P.Makulu.

**MÜŞƏBBƏK** *sif.* [*ər.*] *köhn.* Şəbəkəli, şəbəkəsi olan.

**MÜŞƏMBƏ** *is.* [əsli *ər.* müşəmbə] Su keçirməmək üçün bir və ya hər iki üzünə xüsusi maddə sürtülmüş parça. *Ortada, üstünə*

*müşəmbə salınmış stolun üzərində yanan çıraq ətrafa solğun bir işıq salırdı*. S.Rəhman. *Musa kişi .. masanın müşəmbəsini qaldırıb altına baxdı.* Mir Cəlal. // Müşəmbədən olan, müşəmbədən tikilmiş, üzü müşəmbə olan. *Müşəmbə plaş*. – [Ağabala] *bel kimi iri və bərk əlini kabinənin bozarmış müşəmbə döşəkcəsinə vurub deyərdi..* Mir Cəlal.

**MÜŞƏMBƏLƏMƏ** “Müşəmbələmək”dən *f.is.*

**MÜŞƏMBƏLƏMƏK** *f.* Müşəmbə ilə örtmək, üzünə müşəmbə çəkmək. *Qapını müşəmbələmək*. – [Uşaq:] *Ata, məni ki suya atırsan, bir müşəmbə götür, sandığın ağzını müşəmbələ ki, su dolmasın*. (Nağıl).

**MÜŞƏMBƏLİ** *sif.* Üstünə müşəmbə çəkilmiş. *Müşəmbəli stol.*

**MÜŞƏRRƏF** *sif.* [*ər.*] *köhn.* Şərəflənmiş, şərəfə nail, şərəfli. □ **Müşərrəf etmək** – öz gəlişi ilə şərəfləndirmək. **Müşərrəf olmaq** – özü üçün şan və şərəf bilmək (böyük bir şəxs tərəfindən qəbul edilməsini). [Xacə Mübarək:] *Mövlana Cəmaləddin hüzuri-mübarəkə müşərrəf olmaq istəyir*. M.F.Axundzadə. *Mən elə hacı tanıyıram ki, özünün heç bir zada etiqadı olmaya-olmaya Məkkəyə müşərrəf olur.* Ə.Qəmküsar.

**MÜŞFİQ** *sif.* [*ər.*] Şəfqətli, mərhəmətli, mehriban, ürəyiyumşaq. *Həsrət qalıb doğma yurdun nazlı, müşfiq qucağına; Gözlər yaşlı, boyun bükük vətənsizmi öləcəyəm?* A.İldırım.

**MÜŞK** *is.* [*fars.*] 1. Bir cins ceyranın göbəyindən çıxarılan xoş iyli maddə. *Müşk qara rəngli maddədir*. – [Şeyx Nəsrulla:] *Ətirlərinizin əlası müşkdür ki, ahunun göbəyinin qanından ibarətdir*. C.Məmmədquluzadə.

2. Gözəl iy, ətir. *Müşk qoxumaq*.

**MÜŞKBAR** *sif.* [*fars.*] *klas.* Müşk saçan, ətir saçan.

**MÜŞKBU** *sif.* [*fars.*] *klas.* Müşk qoxulu, müşk kimi ətirli. *Rəhm eylə bu müşkbu qəzalə; Rəhm etməzmi kimi bu halə?* Füzuli.

**MÜŞKÜL** [*ər.*] 1. *sif.* Çətin, zor, çətin başa gələ bilən, çətin həll edilə bilən. *Müşkül hal. Müşkül məsələ. – Mən and içirəm ki, indiyədək* “*Tərcüman*” *qəzetinin sahibi bir belə müşkül işə rast gəlməyib*. C.Məmmədquluzadə. // Ağır, dözülməz. *Səbr eyləmək olarmı bu müşkül müsibətə*. A.Səhhət. □ **Müşkülə düşmək** – çətinə düşmək, çıxılmaz vəziyyətə düşmək. *Vay, vay! Nə yaman müşkülə düşdü işim, Allah! Fəryadimə yet kim, yanıram atəşə, billah!* M.Ə.Sabir. **Müşkül etmək** – çətinləşdirmək, çətinə salmaq, ağırlaşdırmaq. *Ta kuyi-yardə özümə mənzil etmişəm; Asan ikən özüm işimi müşkül etmişəm*. S.Ə.Şirvani. **Müşkül olmaq** – çətin olmaq. *Eşitmədinmi, könül, eşq müşkül olduğunu; Sənə bu müşkül işi kim dedi ki, bünyad et!* Füzuli. *Müşkül oldu çünki yol bulmaq onun imkanına; Göstərib lütfü-kərəm mən bəndeyi-fərmanına.* M.P.Vaqif; // ağır olmaq, dözülməz olmaq. *Elmsizlik bəlası müşkül olur, həqiqət.* M.Ə.Sabir.

2. *is.* Çıxılmaz vəziyyət, ağır vəziyyət; düyün. *Müşkülü həll etmək. – Sən tanıtdın bu ellərə ömrün yazını; Varlıqdakı hər müşkülün öz mənasını.* S.Rüstəm. [Mahmud üçün] *bu böyük müşküldən çıxmağa bir yol var idi, o da intihar!* Çəmənzəminli.

3. *məc. sif.* Ağır, çox. *Bu məlul, müşkül vaxtında Nigarın küsməyi Koroğlunun ürəyini qubarlandırdı.* “Koroğlu”.

**MÜŞKÜLAT** *is.* [*ər.* “müşkül” söz. cəmi] 1. Həlli çətin iş; çətinlik, əngəl, maneə. *Kim eylədi həll müşkülatın; Kim verdi bu qüssədən nicatın?* Füzuli. *Burada Ceyranın qarşısına yeni bir müşkülat çıxır.* S.Hüseyn.

2. **Müşkülatla** şəklində *zərf* – çətinliklə. *Bu bir min ədədi ki, belə müşkülatla düzəldə bildik, iki min ədədə gücümüz çatsa, genə min şükür eləməli.* C.Məmmədquluzadə.

**MÜŞKÜLCƏ** *sif.* Çox müşkül, çox çətin. *Müşkülcə xitabdır xitabın; Bilməm necə verəyim cavabın.* Füzuli.

**MÜŞKÜLLƏŞDİRMƏ** “Müşkülləşdirmək”dən *f.is.*

**MÜŞKÜLLƏŞDİRMƏK** *f.* Çətinləşdirmək.

**MÜŞKÜLLƏŞMƏ** “Müşkülləşmək”dən *f.is.*

**MÜŞKÜLLƏŞMƏK** *f.* Daha da müşkül olmaq, daha da çətin olmaq; çətinləşmək.

**MÜŞKÜLLÜK** *is.* Çətinlik, ağırlıq.

**MÜŞRİK** *sif.* [*ər.*] Bütpərəst, müsəlman dinində olmayan.

**MÜŞTAQ** *sif.* [*ər.*] *şair.* Candan istəyən, həsrətində olduğu bir şeyə can atan, arzu-

sunda olan. *Onun üçün göz kəsmərəm gözündən; Müştaqəm, ey şəkər kanı, mən sənə.* M.P.Vaqif. *Ələsgər müştaqdır xəttü-xalına; Məleykə şəklinə, mah cəmalına.* Aşıq Ələsgər. *Ey mənim dostum, gərək sən heç şübhə etməyəsən ki, mən sənintək vücudları görməyə müştaqəm.* C.Məmmədquluzadə. □ **Müştaq olmaq** – candan istəmək, arzu etmək, ürəkdən bağlanmaq, həsrətində olmaq. *Bəlli Əhməd Koroğlunun sədasını eşidib ona müştaq olmuşdu.* "Koroğlu". *Didarına müştaq olan əhli-beyt; Yüzün görüb şadü-xürrəm olubdur.* Q.Zakir.

**MÜŞTƏBEH** *sif.* [*ər.*] Şübhəli, şəkli. □ **Müştəbeh etmək** – şübhələndirmək, şəkləndirmək; şəkkə, şübhəyə salmaq. [Divanbəyi:] *Bular da məni aşkar istəyirlər müştəbeh etsinlər*. M.F.Axundzadə. **Müştəbeh olmaq** – şübhələnmək, şübhəyə düşmək. [Ağa Kərim:] *Səni Hacı Qafurun arvadının yanında elə nəzərə verdim ki, əgər özün də orda olsaydın öz haqqında müştəbeh olardın*. M.F.Axundzadə. *Olduqca müştəbeh "qələt etmə, inan!" – dedin; Kim yaxşı söylədisə ona min yaman dedin.* M.Ə.Sabir.

**MÜŞTƏRƏK** *sif.* [*ər.*] 1. Ümumi, ellik, birgə; elliklə, ortaqlı, birgə görülən (aparılan); kollektiv. *Müştərək iş. Müştərək əkin. – Bütün kənd Novruza müştərək kağız yazıb göndərdi.* S.Rəhimov. // Zərf mənasında. *Müştərək işləmək.* □ **Müştərək müqavilə** – müəssisənin müdiriyyəti ilə həmkarlar ittifaqı təşkilatı arasında bağlanan əmək müqaviləsi. **Müştərək təsərrüfat** – kolxozun köhnə adı.

2. Ümumi, bənzər, oxşar. [Çiçəklə] *Xədicə arasında müştərək bəzi sifətlər bulurdum*. S.Hüseyn.

**MÜŞTƏRƏKLİK** *is.* Müştərək olma, birgə olma; əlbirlik, şəriklik, ortaqlıq.

**MÜŞTƏRİ**[1] *is.* [*ər.*] 1. B a x **alıcı**[1] 1-ci mənada. *Müştərilərə mədəni xidmət. Bu malın müştərisi yoxdur*. – [Hacı Qara:] *Bunların qumaşı özgə qumaşdır, müştəri macal vermir, göydə götürür.* M.F.Axundzadə. *Bu arada müştərilər hərlənir, qiymət üstündə uzun-uzadı çəkişirdilər.* S.Rəhimov.

2. Daimi alıcı, sifarişçi və ya bir iş üçün gələn. *Atelyenin müştərisi. – Əti də Şeyx Şaban hər qəssabdan almazdı. Qəssabbaşı İmaməli ilə müştəri idi.* Ə.Haqverdiyev. *Usta bir müştərinin başını qırxıb, qurtarıb qanatdığı yerlərə pambıq düzürdü.* C.Məmmədquluzadə.

3. Pul müqabilində su, elektrik, telefon, radio və s.-dən istifadə edən, habelə qəzet, jurnal və s.-yə abunəçi olan şəxs. *Bir qədər müştərimiz Bakı, Gəncə, Şamaxı və qeyri şəhərlərdə varımızdır*. C.Məmmədquluzadə. [Cənnətəli] *axırda qəzetlərə bir qədər müştəri toplayıb, Bakıya gedib ki, görsün, onun kəlamını niyə çap eləməyiblər*. Çəmənzəminli.

4. *məc.* İstəyən, arzu edən, həvəskar. [Hacı Fərəc:] *Zinyət xanıma müştəri çoxalacaq, yatma, sərhesab ol, kişi!* N.Vəzirov. *Adına min yerdən min müştəri var.* S.Vurğun. □ **Müştəri çıxmaq** – 1) yiyələnmək, mənimsəmək istəmək. *Kitaba müştəri çıxmaq;* 2) b a x **müştəri olmaq**. **Müştəri olmaq** – istəmək, almağa hazır olmaq, almaq istəmək. *Varın verən, deyərlər, utanmaz, məsəldi bu; Can nəqddi əldə, oldum o canənə müştəri*. S.Ə.Şirvani. *Camalın görən olur müştəri; Misirdə Yusifin bazarı kimi.* Aşıq Ələsgər.

◊ **Müştəri gözü ilə baxmaq** *zar.* – bir həvəskar, maraqlanan bir adam alıcı gözü ilə baxmaq, qiymətləndirmək. *Səlimnaz hər gün* [Püstəxanımı] *iş gördürmək bəhanəsi ilə evinə çağırır, altdan-altdan, oğrun-oğrun müştəri gözü ilə ona baxırdı.* M.Hüseyn. [Əşrəf:] *Ümid, .. bir o həkim qıza müştəri gözü ilə baxarsan*. B.Bayramov.

**MÜŞTƏRİ**[2] *is.* [*ər.*] Ərəb astronomiyasında: Yupiterin adı. *Dəst tutsun Ütarid, Zöhrə, Müştəri; Fələkin şəmsilə mahı oynasın*. Q.Zakir.

**MÜŞTƏRİGİR** *sif.* [*ər.* müştəri və *fars.* ...gir] *köhn.* Alıcını cəlb edən, işə gedən, müştəri bəyənən, alıcısı, həvəskarı çox olan. *Müştərigir mal.* □ **Müştərigir olmaq** – alıcının xoşuna gəlmək, müştərinin ürəyinə yatmaq, müştərisi çox olmaq. [Hacı Qara:] *Mal gərək müştərigir olsun*. Ə.Haqverdiyev.

**MÜŞTÜK** *is.* [əsli *alm.* mundstuck] 1. Papiros gilizinin içində tütün olmayan, çəkər-

kən ağıza salınan bərk hissəsi, papiros kötüyü. // Papiros və siqaretin keçirildiyi kiçik borucuq. *Siqareti müştüyə keçirmək.* – [Mehrəli] .. *gilas ağacından qayrılmış uzun müştüyünü üfləyib, papirosu ucuna qondardı.* Çəmənzəminli. *Molla uzun və qara müştüyün başına sancılmış eşmə papirosa qullab vuraraq ətrafına tüstü yayırdı.* T.Ş.Simurq.

2. Nəfəsli musiqi alətlərinin ağıza salınan və ya dodağa söykənən hissəsi; ağızlıq. *Klarnetin müştüyü. Fleytanın müştüyü.*

**MÜŞTÜKLÜ** *sif.* Müştüyü olan. *Qısa müştüklü papiros.* – ..*Şahmar dəftərxanadan çıxıb uzun müştüklü papirosunu yandırdı...* M.Hüseyn. // Müştükdə olan, müştüyə keçirilmiş. *Müştüklü siqaret.*

**MÜTABİQ** *sif.* [*ər.*] Bir-birinə uyan, tay gələn; uyğun, müvafiq. *Əhkami-şərə mütabiq bir .. kimsənə nəzərdə varmı ki, səltənəti və taxtü-tacı ona vagüzar edək.* M.F.Axundzadə. ◻ **Mütabiq gəlmək** – eyni ölçüdə, biçimdə olmaq, bir-birinə uyğun gəlmək, bir-birindən fərqli olmamaq. **Mütabiq olmaq** – eyni ölçüdə, biçimdə olmaq, tən gəlmək, müvafiq olmaq. *Olmuş dünümə günüm mütabiq; Gün görməz imiş bəlalı aşiq*. Füzuli. **Mütabiq tutmaq** – bir-birinin eyni hesab etmək, iki şeyin arasında heç bir fərq görməmək, bir tutmaq.

**MÜTABİQƏT** [*ər.*] b a x **mütabiqlik**.

**MÜTABİQLİK** *is.* Bir qaydada olma, bir-birinə uyğun gəlmə; uyğunluq, müvafiqlik.

**MÜTALİƏ** *is.* [*ər.*] 1. Oxuma, qiraət. *Hacı Nurməmməd də elə bizim öz şəhərimizdə nüsxəbənd kitablarının mütaliəsi və təcrübə ilə həkimliyi öyrənmişdi.* C.Məmmədquluzadə. *Cəmi yeddiillik təhsili olan Gülaçar qızğın mütaliə həvəskarı idi.* İ.Əfəndiyev. ◻ **Mütaliə etmək (eləmək)** – kitab, qəzet, jurnal və s. oxumaq. [Musanın nəvəsi] *mütaliə edir, çalışır, elmin bir şöbəsində özünü mütəxəssis hesab edir*. Qantəmir. *Bir axşam ürəyim yenə təngləşdi. Mütaliə etdiyim kitabla maraqlana bilmədim.* T.Ş.Simurq. // Kitab və s.-dən əxz edilmiş bilik, məlumat mənasında.

2. Ətraflı düşünmə, götür-qoy etmə, fikirləşmə. *Məsələni əvvəlcə mütaliə etmək lazımdır.*

**MÜTALİƏÇİ** *is.* Mütaliə ilə məşğul olan, qiraət edən, mütaliəni çox sevən adam.

**MÜTALİƏSİZ** *sif.* və *zərf* Düşünmədən, fikirləşmədən, götür-qoy etmədən.

**MÜTARİKƏ** *is.* [*ər.*] Hər iki tərəfin razılığı ilə müharibənin müvəqqəti olaraq kəsilməsi, dayandırılması. *Mütarikə etmək.*

**MÜTƏAQİB** *sif.* [*ər.*] 1. Bir-birinin arxasınca gələn, bir-birini təqib edən.

2. Dalısınca, arxasınca, ondan sonra. [Ərən:] *Bunu mütəaqib gözəl üzlü, qəvi əndamlı gənc bir oğlan da gəldi*. Çəmənzəminli.

**MÜTƏARİF** *sif.* [*ər.*] *köhn.* 1. Məlum, məşhur, bilinən, tanınan. // Xəbər şəkilçisi ilə: **mütəarifdir** – tanınır, məşhurdur. *Mirzə Fətəli "Səbuhi" təxəllüsü ilə mütəarifdir.* F.Köçərli.

2. Adi, həmişəki. *Molla İbrahimxəlil tez mütəarif ev libasında .. çadırın qabağında durub şagirdi Molla Həmidi çağırdı.* M.F.Axundzadə. *Müəllim* [Molla Xəlilin] *qapısından ötüb keçdikdə "Yolunuzu yaxın ediniz! Qulluğunuzda olaq! – kimi mütəarif sözlərlə onu evinə çağırmışdısa da, məqsədinə yetişə bilməmişdi.* S.Hüseyn.

**MÜTƏDAVİL** *sif.* [*ər.*] Bir adət, moda halını almış; işlək, adi. *Mütədavil şey. – Vəkil dəllallığı bir mütədavil peşə idi.* Ə.Haqverdiyev. ◻ **Mütədavil olmaq** – işlək olmaq, dəbdə olmaq, tədavüldə olmaq. *Bu tərəfdən nəzmi-məmləkət üçün mütədavil olan tərzi-siyasət hər aqili təhəyyürə salır*. M.F.Axundzadə. [Murad] *hər qisim ev maşınları* [təmir] *edər, o zaman çox mütədavil olan papiros-yandıran qayırıb satardı*. S.Hüseyn.

**MÜTƏƏLLİM¹** *sif.* [*ər.*] *köhn.* Elm öyrənən, təhsil alan, dərs alan. [Xanmirzə bəy:] ..*Bu gün məni tutub güclən müsəlman teatrına aparmaq istəyirdilər. Nədi ki, bəs, kasıb mütəəllimlərə pul yığacayıq.* N.Vəzirov.

**MÜTƏƏLLİM²** *sif.* [*ər.*] *köhn.* Ələmli, qəmli, qüssəli.

**MÜTƏƏSSİB** *sif.* [*ər.*] 1. Öz adət və ənənələrini saxlamaqda ifratçılıq göstərən. ..*Qeyrilər bizə görə öz dillərini və yazılarını çox işlədirlər, bu ondan ötrü deyil ki, onlar bu barədə bizdən mütəəssib və qeyrətlidirlər.* C.Məmmədquluzadə. // *məc.* Bir şeyə dərin

sədaqət bəsləyib onu ehtirasla müdafiə edən adam. *Səhnədə Elxanla Aqşin qarşı-qarşıya durub öz məslək və dininin üstünlüyünü ən mütəəssib bir şəxs kimi müdafiə edirdi*. M.Arif.

2. Qatı dindar olub, kor-koranə yeniliyə, mədəniyyətə, tərəqqiyə düşmən olan. *Ümum camaatın da qaliba mütəəssib və avamlığını da mülahizə edəndə tamam məyusluq və naümidlik üz verirdi*. C.Məmmədquluzadə.

**MÜTƏƏSSİF** *sif.* [*ər.*] Təəssüf edən, təəssüflənən, kədərlənən, özünə dərd edən, heyifsilənən. *Əsmərin uşağı olmayırdı, Məmmədbağır bundan mütəəssif də deyildi.* S.Hüseyn. □ **Mütəəssif olmaq** – təəssüflənmək, təəssüf etmək, kədərlənmək, heyifsilənmək. *Biz onu divanə hesab edib qüvveyi-əqliyyəsində vaqe olan xələl cəhətindən onun halətinə mütəəssif olacağıq*. M.F.Axundzadə.

**MÜTƏƏSSİR** *sif.* [*ər.*] Bir hal və hissin təsiri ilə dəyişilmiş, qüssələnmiş, dərdlənmiş, əhvalı pozulmuş, təsirlənmiş. *Mütəəssir hal. – Zeynal çox mütəəssir idi*. S.Hüseyn. □ **Mütəəssir etmək** – halını dəyişdirmək, kefini pozmaq, əhvalını pozmaq, kədərləndirmək, təsirləndirmək. *Möhsünzadə bir qədər həssas adam idi. Onu hər şeydən artıq aralıqda qalacaq uşaqların faciələri mütəəssir edirdi.* S.Hüseyn. **Mütəəssir olmaq** – əhvalı pozulmaq, qüssələnmək, kədərlənmək, təsirlənmək. *Səkkiz il əvvəl olan bu əhvalatı Cəmil xatırlayırdısa da, yenə mütəəssir olmurdu*. Mir Cəlal.

**MÜTƏFƏKKİR** [*ər.*] 1. *is.* Dərin fəlsəfi fikir sahibi olan adam. *Qədim yunan mütəfəkkirləri. Böyük mütəfəkkir və şair Nizami.*

2. *sif.* və *zərf klas.* Fikirli, fikirli-fikirli, fikir-xəyal içində olan, dalğın. *Əvvəl hakimi-şər mütəfəkkir ayağa durub gedir*. M.F.Axundzadə. *Cavad çıxır, Nəcəf bəy xeyli vaxt mütəfəkkir gəzinir*. Ə.Haqverdiyev. [Mənsur] *mütəfəkkir evə girib dalınca qapını örtdü*. C.Cabbarlı.

**MÜTƏFƏKKİRANƏ** *zərf* [*ər.* mütəfəkkir və *fars.* ...anə] bax **mütəfəkkir** 2-ci mənada. [Rzaquluxan] *deyəsən, bir nəfər gözləyir kimi mütəfəkkiranə baxırdı*. M.S.Ordubadi.

**MÜTƏĞƏYYİR** *sif.* və *zərf* [*ər.*] Dəyişmiş, başqalaşmış, əsil hal və surətini itirmiş, başqa hala (şəklə) düşmüş. *Padşahın qızı* (*mütəğəyyir*): *– Söylə, söylə!* Ə.Haqverdiyev. *Fərhad bilirdi ki, Aslan onun halını mütəğəyyir görüb tez soracaq*. C.Cabbarlı. □ **Mütəğəyyir olmaq** – halı, sir-sifəti dəyişmək, haldan, sifətdən dönmək, pozulmaq. *Saqi, mütəğəyyir oldu halım; Söyləməyə qalmadı məcalım!* Füzuli.

**MÜTƏHƏRRİK** *sif.* [*ər.*] Hərəkət edən, bir yerdə qərar tutmayan; oynaq. *Mütəhərrik kölgələr gedir, gəlir, Əzizin başına toplanırdı.* Ə.Əbülhəsən. [Casus] *bayquş kimi boyunsuz, bədəninə görə yekə, lakin mütəhərrik başını əcaib və iyrənc bir surətdə hərləyib düz arxasına, indicə girdiyi qapıya baxdı*. M.Rzaquluzadə.

**MÜTƏHƏRRİKLİK** *is.* Hərəkətdə olma vəziyyəti; hərəkət etmə, dövr etmə.

**MÜTƏHƏYYİR** *sif.* [*ər.*] Özünü itirmiş, nə edəcəyini bilməyən, heyrətə düşmüş, çaşmış, çaşıb qalmış. *Mütəhəyyir adam*. // *zərf* Heyrət içində, çaşmış halda. *Şah Abbas mat və mütəhəyyir tamaşa edir*. Ü.Hacıbəyov. *Gövhərtac özünü köməksiz görüb mat, mütəhəyyir divara yapışdı*. Ə.Haqverdiyev. □ **Mütəhəyyir qalmaq** – çaşıb qalmaq, heyrət içində qalmaq, təəccüblənmək, donub qalmaq, heyrətlənmək. *Bu sözlərdən Hatəmxan ağa bir az mütəhəyyir qalır*. M.F.Axundzadə. [Muzdur] *saysız yüzlükləri kağız arasında gördükdə biixtiyar onları yerə buraxıb mütəhəyyir qaldı*. S.M.Qənizadə.

**MÜTƏHƏYYİRANƏ** *zərf* [*ər.* mütəhəyyir və *fars.* ...anə] Çaşmış halda, heyrət içində, təəccüblə. *Mütəhəyyiranə ətrafa baxmaq.*

**MÜTƏXƏSSİS** *is.* [*ər.*] Elm və ya texnikanın müəyyən sahəsində xüsusi biliyi olan, müəyyən ixtisas almış adam, ixtisas sahibi. *Gənc mütəxəssis. Mütəxəssislərə qayğı bəsləmək. – İndi Bakı neft sənayesi şöhrəti uzaqlara yayılmış güclü mütəxəssislərə malikdir.* İ.Əfəndiyev. *Vahid heç bir mənsəb sahibi olmasa da, mütəxəssislər arasında böyük hörməti var idi.* Mir Cəlal.

**MÜTƏXƏSSİSLİK** *is.* Mütəxəssis olma, ixtisas sahibi olma.

**MÜTƏKƏBBİR** *sif.* [*ər.*] Lovğa, özündən razı; təkəbbürlü, məğrur, dikbaş. *O vaxt acıqlı, qaşqabaqlı və mütəkəbbir müəllimlər ilə saziş eləmək doğrudan da ən çətin məsələlərdən birisi idi.* F.Köçərli. [Zeynəb] *kişilərə qarşı daimi mütəkəbbir və nifrət edər kimi dayanardı.* Qantəmir. *Firəngiz həmişəki kimi ciddi və mütəkəbbir idi*. H.Seyidbəyli.

**MÜTƏKƏBBİRANƏ** *zərf* [*ər.* mütəkəbbir və *fars.* ...anə] Təşəxxüslə, təkəbbürlə, özünü dartaraq, lovğa-lovğa, məğruranə, dikbaşlıqla. *Qulamxan mütəkəbbiranə salam verib yuxarı başda əyləşir*. M.S.Ordubadi.

**MÜTƏKƏBBİRLİK** *is.* Mütəkəbbir olma, özünü dartma; lovğalıq, məğrurluq, dikbaşlıq.

**MÜTƏKKƏ** *is.* [*ər.*] Uzunsov, dəyirmi balış. *Mütəkkəyə dirsəklənmək. – Qonaq çadrasını başından açmayıb, oturdu mütəkkənin qabağında salınan döşəyin üstdə.* E.Sultanov. *Səfər cəld əlini mütəkkənin altına uzadıb xəncərini götürdü.* Çəmənzəminli.

**MÜTƏQABİL** *sif.* və *zərf* [*ər.*] 1. Qarşı, qarşı-qarşıya olan, biri o birinin qarşısında olan. *Mütəqabil tərəf. Mütəqabil durmaq.*

2. Qarşılıqlı. *Mütəqabil yardım. – Mütəqabil məhəbbətlə dolu iki qəlb bir-birini danışıqsız anlayırdı*. T.Ş.Simurq. *Mütəqabil köməklik hər zaman mümkündür*. M.S.Ordubadi.

**MÜTƏLLA** *sif.* [*ər.*] *köhn.* Qızıl suyuna çəkilmiş, zərli.

**MÜTƏLLİM** *sif.* [*ər.*] *köhn.* b a x **mütəəllim**[1].

**MÜTƏMADİ** *sif.* [*ər.*] Sürəkli, ara verməyən, davamlı, daimi surətdə baş verib gedən. *O gündən etibarən Qurbanlı mütəmadi ziyarətlərə davam etdi.* Çəmənzəminli. *Mütəmadi fikir, şiddətli ürək döyüntüsü* [Əzizbəyovu] *yatmağa qoymurdu*. M.Hüseyn. // *zərf* Daim, arasıkəsilmədən, mütəmadiyən. *Axşam Dilbər xörək yemir, mütəmadi ağlayırdı.* C.Cabbarlı.

**MÜTƏMADİYƏN** *zərf* [*ər.*] Aramsız, ara vermədən, fasiləsiz, daim. *Soyuq külək şiddətlə əsir, pəncərə şüşələrini mütəmadiyən cingildədirdi.* M.Hüseyn.

**MÜTƏNASİB** *sif.* [*ər.*] 1. Bir-birinə uyğun gələn, müvafiq olan, müntəzəm, bir nisbətdə olan. // Üz və bədən üzvləri bir-birinə tam uyğun olan; tənasüblü. [Xanım] *uzun mütənasib boylu, sağlam bədənli, iri qara gözlü bir qadın idi.* H.Nəzərli. *Bəstəboy, mütənasib bədənli bu şux gəlin qızdan seçilmirdi.* B.Bayramov.

2. *riyaz.* Kəmiyyətlərindən birinin artıbəskilməsindən asılı olaraq eyni dərəcədə artıb-əskilən. *Düz mütənasib kəmiyyətlər.*

**MÜTƏNASİBLİK** *is.* Hissələri arasında tam uyğunluq; tənasüblük. *Abidənin mütənasibliyi. Bədənin mütənasibliyi.*

**MÜTƏNCƏM** *is. aşp.* Tikə ətdən, qaysı, kişmiş və albuxaradan bişirilən xuruş. *Bişdikcə qazan-qazan mütəncəm; Yad et məni, yağlı-yağlı yad et!* M.Ə.Sabir.

**MÜTƏRCİM** *sif.* [*ər.*] Tərcüməçi, tərcümə edən. *..Bu müəssisə də daimi bir mütərcim saxladığı üçün* [Zeynalın] *oradan da əli çıxmışdı.* S.Hüseyn. [Firəng:] *Ağa mənim yanımca gələn mütərcim vasitəsilə arvadıma dedi..* Ə.Haqverdiyev.

**MÜTƏRCİMLİK** *is.* Tərcüməçilik.

**MÜTƏRƏDDİD** *sif.* [*ər.*] Müəyyən qərara gələ bilməyən, qərarsız, çaş-baş qalmış, tərəddüd edən. *Mütərəddid adam. – Ana mütərəddid halda bir xeyli səssiz dayanıb, köksünü ötürə-ötürə oğluna baxdı.* M.Hüseyn. [Aydın] *mütərəddid halda ovçuya, sonra divardakı şəkillərə baxdı*. H.Seyidbəyli. ☐ **Mütərəddid qalmaq** – çaş qalmaq, qəti qərara gələ bilməmək, tərəddüd içində olmaq. *İndi Telli mütərəddid qalmışdı*. S.Hüseyn. [Bəhram] *da həmişə bir iş görəndə mütərəddid qalardı*. Ə.Vəliyev.

**MÜTƏRƏDDİDLİK** *is.* Tərəddüd etmə, qəti qərara gələ bilməmə, çaş qalma; qətiyyətsizlik. *Bəzi mühərrirlərin xırda burjua mütərəddidliyi, .. məhdudluğu jurnalın səhifələrində əks olunmaya bilməzdi.* M.İbrahimov.

**MÜTƏRƏQQİ** *sif.* [*ər.*] 1. Siyasi, ictimai və iqtisadi cəhətdən qabaqcıl, ictimai inkişafa kömək edən; qabaqcıl. *Mütərəqqi bəşəriyyət.* – [Həkim] *bu işlərə qarışmasa da çox fikriaçıq və mütərəqqi bir şəxsdir*. M.İbrahimov.

2. Getdikcə artan, mütənasib surətdə çoxalan. *Mütərəqqi əmək haqqı.*

**MÜTƏRƏQQİLİK** *is.* Mütərəqqi olma, inkişafa kömək etmə; qabaqcıllıq.

**MÜTƏŞƏKKİL** *sif.* [*ər.*] 1. Təşkil olunmuş, ciddi nizam və intizama tabe. *Mütəşəkkil mübarizə. Mütəşəkkil fəhlə hərəkatı.* – *..Hərəkata səthi bir nəzər salanda .. mütəşəkkil və müntəzəm əllər tərəfindən düzəldiyi məlum olurdu.* M.S.Ordubadi.

2. Müəyyən bir məqsəd üçün birləşmiş, hər hansı bir təşkilata, cəmiyyətə və s.-yə daxil olmuş. *Proletariatın mütəşəkkil dəstəsi.*

**MÜTƏŞƏKKİLLƏŞDİRMƏ** "Mütəşəkkilləşdirmək"dən *f.is.*

**MÜTƏŞƏKKİLLƏŞDİRMƏK** *f.* Mütəşəkkil şəklə salmaq, müəyyən qayda və qanuna tabe etdirmək, nizama salmaq.

**MÜTƏŞƏKKİLLƏŞMƏ** "Mütəşəkkilləşmək"dən *f.is.*

**MÜTƏŞƏKKİLLƏŞMƏK** *f.* Mütəşəkkil şəklə düşmək, müəyyən qayda və qanuna tabe olmaq, mütəşəkkil olmaq.

**MÜTƏŞƏKKİLLİK** *is.* Mütəşəkkil şeyin hal və keyfiyyəti. *Mübarizənin mütəşəkkilliyi.*

**MÜTƏVƏCCEH** *sif.* [*ər.*]: **mütəvəcceh olmaq** – 1) qulluq etmək, qayğısını çəkmək, baxmaq, gözü üstündə olmaq, muğayat olmaq. *Uşaqlara mütəvəcceh olmaq.* – [Məmmədhəsən əmi] *gecə və gündüz bu heyvana mütəvəcceh olur ki, onu yolda qoymasın.* C.Məmmədquluzadə. *Şeyx Şabanın bu halətindən heç kəs ona mütəvəcceh olmurdu.* Ə.Haqverdiyev; 2) üzünü tutmaq, müraciət etmək; // fikir vermək, diqqət yetirmək. *Oğlan gəlmişəm, ay dərdin mənə gəlsin, ərzimə mütəvəcceh ol..* E.Sultanov. *Şah bəşaşət ilə mollabaşıya mütəvəcceh olub sual etdi.* M.F.Axundzadə. *Doktor bundan sonra Münəvvər xanıma mütəvəcceh olub deyirdi..* M.S.Ordubadi.

**MÜTİ** *sif.* [*ər.*] İtaət edən, hər şeyə boyun əyən, tabe olan, itaətli. – *Görmə! – Baş üstə, yumaram gözlərim. – Dinmə! – Mütiəm, kəsərəm sözlərim.* M.Ə.Sabir. *Şərif ki hər zaman* [Molla Xəlilin] *müti və itaətkar bir müridi idi, bütün bayır işlərini ona gördürərdi.* S.Hüseyn.

**MÜTİCƏSİNƏ** *zərf* Hər əmrə, buyruğa hazır vəziyyətdə, tabe halda. *Müticəsinə qulaq asmaq. Müticəsinə əmri yerinə yetirmək.*

**MÜTİLƏŞDİRMƏ** "Mütiləşdirmək"dən *f.is.*

**MÜTİLƏŞDİRMƏK** *f.* İtaətə, boyun əyməyə, tabe olmağa, hər əmri yerinə yetirməyə məcbur etmək.

**MÜTİLİK** *is.* Müti adamın vəziyyəti, itaət, hər şeyə boyun əymə. *Muxtar bir uşaq mütiliyi ilə gözlərini döydü, papirosunu sümürə-sümürə çadırdan çıxdı.* B.Bayramov.

**MÜTLƏQ** *zərf* [*ər.*] 1. Labüd, şübhəsiz, əlbəttə, yəqin, hər halda. *Həqiqət axtarılan yerdə də mütləq ixtilaf olur.* C.Məmmədquluzadə. [İsmət:] *Getmiş, artıq əsər yox qəhrəmandan; Mütləq məni eyləyirmiş imtahan.* H.Cavid. // Hər necə olur olsun, hər bir halda, qeydsiz-şərtsiz. *Kitabı mütləq mənə çatdır. Sabah mütləq sizə gələcəyəm. Bu gün mütləq gəlməlidir.* – [Zinyət:] *Öz-özümə söz vermişəm ki, payızda işimiz az olanda mütləq bir də gedəm.* S.Rəhman.

2. Əsla, heç, qətiyyən, qəti surətdə. *Məhv olub onda mərdlik əsəri; Mütləq olmaz şücaətə cigəri.* Füzuli. *Mən cahan mülkündə mütləq doğru halət görmədim.* M.P.Vaqif.

3. İdealist fəlsəfədə: bütün varlığın daimi, dəyişməz ilk əsası (ruh, ideya, Allah).

4. Müqayisə xaricində, heç bir hadisə, şərait və s.-dən asılı olmayaraq götürülən. *Əhalinin mütləq artımı.*

◊ **Mütləq monarxiya** – b a x **mütləqiyyət**. **Mütləq sıfır** – mümkün olan ən alçaq temperatur (mənfi 273,16°C). **Mütləq çempion** – müəyyən idman növünün hər hansı bir dərəcəsində yarış zamanı ən çox xal qazanmış idmançı. **Mütləq çoxluq** – böyük əksəriyyət.

**MÜTLƏQA** *zərf* [*ər.*] 1. Mütləq, əlbəttə, hər necə olursa, hökmən, sözsüz, danışıqsız, şübhəsiz. *Belə bir qənaət var idi ki, artist mütləqa suflyor altında getməlidir.* S.Rəhman. [Mirzə Həsən:] *Bundan mütləqa istifadə etmək və xalqı bir daha hərəkətə gətirmək lazımdır.* P.Makulu.

2. Qətiyyən, əsla. *Bunlar mənə əsər eylərmi? Mütləqa yox! Yox!* C.Cabbarlı.

**MÜTLƏQİYYƏT** *is.* [*ər.*] Ali dövlət hakimiyyətinin bir nəfərin – padşahın əlində olduğu idarə üsulu, qeyri-məhdud monarxiya, mütləq hakimiyyət. *İnqilabi hərəkat geniş-*

*lənərək mütləqiyyəti daha artıq sarsıtdıqca mətbuat və söz azadlığı üçün nisbətən geniş şərait yaranır.* M.İbrahimov.

**MÜTLƏQİYYƏTÇİ** *is.* Mütləqiyyət tərəfdarı; mütləqiyyətə əsaslanan.

**MÜTRÜB** *is.* [*ər.* mütrib] 1. Keçmişdə musiqinin müşayiəti ilə toylarda rəqs edən oğlan (bəzən qız). *..Qorxurdum ki, özlərinə bir qəpik də saxlamayalar ki, mütrüb-zad oynadanda şabaş verələr.* C.Məmmədquluzadə. *Dəfçalan, zurnaçı, balabançı, mütrüb də manqalın başında oturardı.* H.Sarabski.

2. *dan.* Hərəkət və danışığında yüngül, qeyri-ciddi adam haqqında; oyunbaz. *Mütrübün biridir*. – [Molla Güləndam Hürzada:] *Ay qız, ey mütrüb, mən sındırmalı qoz deyiləm sındırasan..* Çəmənzəminli.

**MÜTRÜBLÜK** *is.* Özünü mütrübə oxşatma, oyun çıxartma; yüngüllük, oyunbazlıq.

**MÜTTƏFİQ** *is.* [*ər.*] 1. Birlikdə hərəkət etmək və ya başqa bir məqsəd üçün ittifaq bağlamış tərəflərdən hər biri. *Müttəfiqinə kömək etmək. Müttəfiqlərin birgə hərəkəti.* – *Müttəfiqlərin təyyarələri çox vaxt .. kiçik meydançanın üstündən uçub gedirdi.* S.Vəliyev. ☐ **Müttəfiq olmaq** – birgə hərəkət etmək üçün saziş bağlamaq, ittifaqa daxil olmaq.

2. Həmfikir, həmrəy, əlbir, yekdil. [Yaşlı kişi:] *Fəqət müxtəlif məzhəb və təriqətlərə mənsub olan müsəlmanlar hamısı bu barədə müttəfiq deyillər.* S.Hüseyn. ☐ **Müttəfiq olmaq** – həmrəy olmaq, həmfikir olmaq, birləşmək. *..Hər bir yanda ki, camaat istəsə ittifaq edə, əlbəttə ki, müttəfiq olanlar üçün bu bir məsləhətli iş olacaq*. C.Məmmədquluzadə; // aralarında ittifaq bağlamaq.

**MÜTTƏFİQƏN** *zərf* [*ər.*] Bir səslə, birlikdə, yekdilliklə, həmrəyliklə. *Buranın kamil təbibləri müttəfiqən sənə vacib görürlər, fürsəti fövtə verməyib gedəsən İrəvana.* C.Məmmədquluzadə.

**MÜTTƏFİQLİK** *is.* Müttəfiq olma; ittifaq, həmrəylik, birlik, bağlılıq.

**MÜTTƏHİD** *sif.* [*ər.*] Birləşmiş, birgə.

**MÜTTƏHİM** *is.* [*ər.*] İttiham olunan; günahkar, müqəssir, məhkəmədə ittiham edilən adam. *Müttəhimi dindirmək. Müttəhimin müdafiəçisi.* // Sif. mənasında. [Sədr:] *Müttəhim Baxşının qiyamçılar təşkilatlarına mənsub olmağı haqqında sizin əlinizdə başqa bir sübut varmı?* C.Cabbarlı. ☐ **Müttəhim etmək** – ittiham etmək, təqsirləndirmək, günahlandırmaq. [Səba:] *Bu sirri bir kimsəyə açma, çünki məni sarayın sirlərini satmaqda müttəhim edə bilərlər*. M.S.Ordubadi.

**MÜTTƏHİMLİK** *is.* Müttəhim olma; günahkarlıq, təqsirlilik. *Müttəhimliyi üstündən götürüldü*.

**MÜTTƏSİL** [*ər.*] 1. *sif.* Arasıkəsilməyən, biri-birinin dalınca davam edən; bitişik, bağlanmış.

2. *zərf* Arası kəsilmədən, ara vermədən davam edən. *Bəzi vaxt yağış başlayanda bir həftə müttəsil yağır*. Ə.Haqverdiyev. *Nəriman babasının müttəsil yağdırdığı və bir-birindən vacib sualların bilmirdi hansına cavab versin.* Mir Cəlal.

3. *zərf* Həmişə, hər vaxt, daim, ara-bərəsiz. *Ey Füzuli, müttəsil dövran müxalifdir mana.* Füzuli. [Taybuynuz öküz] *.. müttəsil övqatını zəhmət və məşəqqətdə keçirib, bir kəsdən çəkdiyi zəhmətin əvəzinə razılıq və xoş sifət görmür.* F.Köçərli.

**MÜVAFİQ** *sif.* [*ər.*] Uyğun, uyar, həmahəng. *Sənsən mənə həmdəmi-müvafiq*. Füzuli. [Odunçu və iki oğlu] *musiqinin üsuluna* (*taktına*) *müvafiq odun yarırlar və balta endikcə*, "*hey!*" *edirlər.* Ü.Hacıbəyov. ☐ **Müvafiq olmaq** – uyğun olmaq, münasib olmaq, düz gəlmək. *Olur tədbirimə bir gün müvafiq ruzigar, əlbət.* S.Ə.Şirvani.

2. Münasib, uyğun, yarar, yaraşan, əlverişli. *Student özünə müvafiq bir ömür sürməkdə idi*. Çəmənzəminli. *Güləlioğlu isə fikrini demək üçün müvafiq bir dəqiqə gözlədi.* M.Hüseyn.

3. Razı, həmrəy, həmfikir. [Xəzinədar:] *Çox yaxşı danışırsan! Bu xüsusda bilkülliyə mən səninlə müvafiqəm*. M.F.Axundzadə.

**MÜVAFİQƏT** *is.* [*ər.*] 1. Uyğun gəlmə, düz gəlmə, uyğunluq, münasib olma, münasiblik.

2. Uzlaşma, razılaşma, həmrəylik. *Aralarında müvafiqət yoxdur*.

**MÜVAZİ** *sif.* [*ər.*] Bir istiqamətdə, kəsişmədən yan-yana uzanan. *Müvazi yol. Müvazi*

*xətlər. – ..Uzanan şose yolu ilə müvazi* (z.) *şütüyüb gələn Alagöz çayı gürzə kimi parıldayırdı.* M.Hüseyn.

**MÜVAZİLİK** *is.* Müvazi olma; paralelizm.

**MÜVAZİNƏ(T)** *is.* [*ər.*] 1. *fiz.* Bərabər və əks istiqamətdə olduqlarına görə bir-birini məhv edən qüvvələrin təsiri nəticəsində cismin hərəkətsizlik, sükunət halı.

2. Olduğu vəziyyəti saxlama, vəziyyətdə sabitlik; dayanıqlıq, duruş. *Müvazinətini saxlaya bilməmək.* – [Qüdrət:] *Mən öz müvazinətimi itirirəm, Gülsabah!* C.Cabbarlı. *Zeynal sərxoşluğundan müvazinəsini saxlaya bilmədiyi üçün Mehribana gücü yetmirdi.* S.Hüseyn. [Şəfi] *özünü düzəltmək istədikdə müvazinətini itirib nərdivandan yumbalandı.* Ə.Əbülhəsən.

3. *məc.* Sükunət, sakitlik, aram. *Ona əbədi görünən ruhi müvazinət içərisində sonsuz bir zövq duyurdu.* M.İbrahimov. *Arvadının belə acınacaqlı hala düşməsi onda daxili müvazinət yaratdı.* H.Seyidbəyli.

4. Bərabərlik, tarazlıq, uyğunluq. *Qüvvələrin müvazinəti.*

**MÜVAZİNƏTLƏŞDİRMƏ** "Müvazinətləşdirmək"dən *f.is.*

**MÜVAZİNƏTLƏŞDİRMƏK** *f.* Vəznlərini uyğunlaşdırmaq, tarazlaşdırmaq, bərabərləşdirmək.

**MÜVAZİNƏTLƏŞMƏ** "Müvazinətləşmək"dən *f.is.*

**MÜVAZİNƏTLƏŞMƏK** *f.* Vəznləri uyğunlaşmaq, tarazlaşmaq, bərabərləşmək.

**MÜVAZİNƏTLİ** *sif. xüs.* 1. Müvazinəti olan; vəzncə uyğun, taraz, bərabər.

2. Sabit vəziyyətdə, durumda olan. // Sakit.

**MÜVAZİNƏTLİLİK** *is.* 1. Müvazinəti olan şeyin halı, uyğunluq, tarazlıq, bərabərlik.

2. Sabit vəziyyətdə, durumda olma.

**MÜVAZİNƏTSİZ** *sif.* Müvazinəti olmayan, müvazinəti itmiş.

**MÜVAZİNƏTSİZLİK** *is.* Müvazinəti olmayan şeyin halı; uyğunsuzluq.

**MÜVƏFFƏQ** *is.* [*ər.*]: **müvəffəq olmaq** – nail olmaq, əldə etmək, istəyinə yetişmək, məqsədinə çatmaq. *Zeynal ötəyə-bəriyə müraciət edib sabiq xidmətini geri istəyirdisə də, müvəffəq olmayırdı.* S.Hüseyn.

**MÜVƏFFƏQİYYƏT** [*ər.*] 1. *is.* Bir şeyi əldə etmə, istəyinə, məqsədinə nail olma, işdə əldə edilən yaxşı nəticə; uğur, nailiyyət. *Müvəffəqiyyət qazanmaq. Müvəffəqiyyət əldə etmək. – Usta Zeynal Mirzə Səfərin oğluna xeyir-dua verib, yaxşı yol ilə müvəffəqiyyət diləyib bir qızıl saat da peşkəş verdi.* Ə.Haqverdiyev. *İlk müvəffəqiyyət məndə inam və ruh yüksəkliyi doğurdu.* A.Şaiq.

2. **Müvəffəqiyyətlə** şəklində *zərf* – öhdəsindən gələrək, qarşıya qoyulan məqsədə nail olaraq, qələbə ilə, yaxşı nəticə ilə. *İşləri müvəffəqiyyətlə başa çatdırmaq.* – [Teymur] *yeddinci sinfi bitirib, sənət məktəbinə girmiş, oranı da müvəffəqiyyətlə qurtarmışdı.* M.Hüseyn. *İclasın müvəffəqiyyətlə keçməsinə, kəndlilər arasında canlanmaya baxmayaraq, Malik narahat idi.* M.İbrahimov.

**MÜVƏFFƏQİYYƏTLİ** *sif.* Müvəffəqiyyət qazanan, müsbət nəticə verən, arzu və məqsədə müvafiq olan; yaxşı. *Müvəffəqiyyətli əsər. Müvəffəqiyyətli tamaşa.*

**MÜVƏFFƏQİYYƏTLİLİK** *is.* Müvəffəqiyyətli olma, müsbət nəticə vermə; yaxşılıq.

**MÜVƏFFƏQİYYƏTSİZ** *sif.* Müvəffəqiyyət qazanmayan, müsbət nəticə verməyən, arzu edilən kimi olmayan, pis, uğursuz qurtaran. *Müvəffəqiyyətsiz əməliyyat.*

**MÜVƏFFƏQİYYƏTSİZLİK** *is.* Müvəffəqiyyət olmadığı hal; uğursuzluq, baş tutmama. *Müvəffəqiyyətsizliyə uğramaq. İş müvəffəqiyyətsizliklə bitdi. – Ancaq bu müddətdə yalnız su quşları ovuna getdiyimdən turac-qırqovul ovunda bu ilk müvəffəqiyyətsizlik təbii idi.* M.Rzaquluzadə.

**MÜVƏKKİL** *is.* [*ər.*] Müəyyən bir işi görmək üçün vəkaləti, səlahiyyəti olan adam. *Tədarük müvəkkili. Sığorta müvəkkili. – Pişxidmətbaşıya buyurdu ki: – Qarovul müvəkkillərinə tapşır, qərari-sabiq üzrə hər yerdə qarovul qoysunlar.* M.F.Axundzadə. *..Baş əməliyyat müvəkkili kapitan Tərlanovdan xahiş edirdi ki, ciddi əməliyyatlara onu da özü ilə aparsın.* H.Seyidbəyli.

**MÜVƏKKİLLİK** *is.* 1. Müvəkkil vəzifəsi, müvəkkil işi.

2. Müvəkkilin işlədiyi idarə, müvəkkil idarəsi. *Gəldiyev .. taxıl tədarükü müvəkilliyində*

*çalışanda bir balaca dolaşan kimi olmuşdu.* Mir Cəlal.

**MÜVƏQQƏTİ** *sif.* [*ər.*] Həmişəlik deyil, müəyyən bir müddətdə olan, davam edən (*daimi* əksi). *Müvəqqəti iş.* // Zərf mənasında. *Bir yerdə müvəqqəti yaşamaq. – Murad uzun mühakimələrdən sonra özünə çıxacaq yol tapmışdı ki, müvəqqəti olaraq evdən uzaqlaşsın.* S.Hüseyn. *Müalicə komisyonundan qayıdan kimi Zahid büro çağırıb katibliyi müvəqqəti Gəldiyevə həvalə etmişdi.* Mir Cəlal. // Keçici, ötücü, az vaxt sürüb keçən, sürəksiz. *Müvəqqəti hal.*

**MÜVƏQQƏTİLİK** *is.* Həmişəlik deyil, az bir zaman, müddət üçün olma; keçicilik, ötücülük, sürəksizlik.

**MÜVƏRRİX** *is.* [*ər.*] *köhn.* Tarixçi. *..Burada qeyd olunan sözlər gələcəkdə müvərrixlər üçün bəlkə də xeyli lüzumlu bir material ola bilər.* C.Məmmədquluzadə.

**MÜYƏSSƏR** *sif.* [*ər.*] Asanlıqla hasil olan, asan başa gələn, imkan daxilində olan; mümkün, asan, qolay. *Şah idim mən cahanda izzətlə; Hər murad istəsəm müyəssər idi.* S.Ə.Şirvani. *Oğlan qızı və qız oğlanı görmək ancaq qohumlarda müyəssərdir.* R.Əfəndiyev. ☐ **Müyəssər olmaq** – mümkün olmaq, imkan daxilində olmaq, başa gəlmək, əldə edilə bilmək: nəsib olmaq. [Ağabəyim] *Vaqifi görmüşdü, lakin onun məclisində olmaq, onunla danışmaq hələ ona müyəssər olmamışdı.* Çəmənzəminli. [Hacı Kamyab:] *Hər adama müyəssər olan rütbə deyil.* Ə.Haqverdiyev.

**MÜZAKİRƏ** *is.* [*ər.*] Hər hansı bir məsələ ətrafında müəyyən mülahizə və nəticəyə gələrək qərar çıxarmaq üçün bir yerdə oturub danışıq aparma, fikir mübadiləsi etmə. *Dissertasiyanın müzakirəsi.* – [Şərif:] *Ocaqqulu dayı, onları müzakirədə danışarıq.* C.Cabbarlı. *Bir çox danışıq və müzakirələrdən sonra razılıq əmələ gəldi.* S.Hüseyn. ☐ **Müzakirə etmək** – hər hansı bir məsələni və ya işi həll etmək və müəyyən qərara gəlmək üçün fikir mübadiləsi etmək. *Qərarın layihəsini müzakirə etmək. – Bu maddələri briqadalardan tutmuş mədənlərə qədər hər yerdə müzakirə ediblər.* M.Hüseyn. **Müzakirə olunmaq** – haqqında iclasda, müşavirədə və s.-də danışılmaq, fikir mübadiləsi yeridilmək. *Məhsul hazırlığı, taxıl biçini müzakirə olundu.* Ə.Vəliyev. **Müzakirəyə qoymaq** – müzakirə etmək üçün məsələni iclasa qoymaq. [Həsənqulu bəy:] *Həzərat! Gəlin bu məsələni müzakirəyə qoyaq.* Ü.Hacıbəyov.

**MÜZARE** *is.* [*ər.*] Qrammatikada: qeyri-qəti gələcək zamanın köhnə adı.

**MÜZAYİDƏ** *is.* [*ər.*] Hərrac, auksion.

**MÜZAYİQƏ** *is.* [*ər.*] Əsirgəməmə, qıymama. [Səltənət:] *Bizim fikrimiz həmişə sizin yanınızdadır. Əlimizdən gələnə nə müzayiqə!* Mir Cəlal. ☐ **Müzayiqə etməmək (eləməmək)** – əsirgəməmək, qıymamaq, olan şeyi verməkdən çəkinməmək. *..Bu bədbəxtliyin müqabilində əlimizdən gələnköməkliyi müzayiqə etməyəcəyik.* C.Məmmədquluzadə. [Hacı Mehdi:] *Gərək əlindən gələni müzayiqə eləməyəsən.* Ə.Haqverdiyev. *Mən həqiqətən Tamamı çox istəyirdim və heç bir şeyi ondan müzayiqə etməzdim.* S.S.Axundov. **Müzayiqə(si) yoxdur** – verməyə hazıram, əsirgəmərəm, danmaram, edərəm, etiraz etmərəm. [Hacı:] *..Hərgah cənabınıza canım, malım .. lazım olsa, müzayiqəsi yoxdur!* Çəmənzəminli. [Səfər kişi:] *Baş üstə, mənim əlimdən nə gəlirsə, baş üstə! Müzayiqə yoxdur!* Mir Cəlal.

**MÜZƏFFƏR** *sif.* [*ər.*] *tənt.* Üstün gələn (gəlmiş), zəfər qazanan (qazanmış), qələbə çalan (çalmış); qalib, qalibiyyətli. *Müzəffər qoşun. Müzəffər yürüş. – Müzəffər ordumuz hər gün dənizlər, dağlar aşdıqca; Yerin qəlbində tufanlar, tələtümlər qopub çağlar.* S.Vurğun. *Napoleonun ordusu müzəffər xalq zərbələri altında tar-mar edildi.* M.Hüseyn. ☐ **Müzəffər gəlmək (olmaq)** – üstün gəlmək, qələbə çalmaq, qalib gəlmək (çıxmaq).

**MÜZƏFFƏRİYYƏT** *is. tənt.* Zəfər, qələbə, qalibiyyət.

**MÜZƏFFƏRİYYƏTLİ** *sif. klas.* Qalibiyyətli, qalib gələn, qələbə ilə nəticələnən. *Müzəffəriyyətli ordumuz. Müzəffəriyyətli yürüş.*

**MÜZƏKKƏR** *is.* [*ər.*] Ərəb qrammatikasında: kişi cinsi.

**MÜZƏYYƏN** *sif.* [*ər.*] Zinətlənmiş, bəzənmiş, bəzək verilmiş; zinətli, bəzəkli.

*Rəngarəng gül, giyah ilə müzəyyən çəməndə iki çadır qurulmuşdur.* M.F.Axundzadə. *Otağın iki üzbəüz tərəfi döşəklərlə müzəyyən idi.* T.Ş.Simurq. □ **Müzəyyən qılmaq** – bax **müzəyyən etmək**. *Kövkəblər! Ey səmanı müzəyyən qılan nücum; Etmişdir o yerlərə seyli-qəm hücum?* M.Hadi. "*Şərqi-rus*"*un səhifələrini əsr və zəmanəmizin şüəra və ədibləri öz gözəl və abdar əşar və kəlamları ilə müzəyyən qılırlar*. F.Köçərli. **Müzəyyən etmək** – bəzəmək, zinətləndirmək, bəzək vurmaq. *Fitrət yolunu müzəyyən etdi; Üzün şəmi ilə rövşən etdi*. Füzuli. [Nəsir bəy:] *Təvəqqe edirəm, birinci badəni içək məclisimizi müzəyyən edən iki gözəl xanımların sağlığına*. M.Əliyev.

**MÜZİKL** *is.* [*ing.*] Estrada teatr növü.

**MÜZLİM** *sif.* [*ər.*] *klas.* 1. Qaranlıq, zülmətli. *Müzlim bir gecə.*

2. Məchul, şübhəli, qaranlıq. *O məni özü ilə bərabər, sanki bildiyim və tanıdığım bu dünyadan daha müzlim, daha çirkin bir dünyaya sürükləyirdi.* M.S.Ordubadi. *Gənc qız bu alaqaranlıq otaqda müzlim kölgələr arasında doğma anasını belə Əminə ilə qarışıq salırdı*. Ə.Əbülhəsən.

**MÜZTƏRİB** *sif.* [*ər.*] *klas.* Sıxıntı və iztirab içində olan; çox təşvişli, rahatsız, narahat, iztirablı. *Müztərib könül* (*qəlb*). – *Qoca tarzən Cavadın arvadı müztərib* (z.) *halda tez-tez qapını açıb küçəyə baxırdı və ah çəkərək otağa qayıdırdı.* Ə.Haqverdiyev. *Müztərib muzdur vaqonların pəncərələrinə baxa-baxa vağzalın axır başınacan getdi*. S.M.Qənizadə. [Qurbanəli] *sakit və müztərib oğluna baxır*. H.Nəzərli. □ **Müztərib etmək** – iztiraba salmaq, rahatsız etmək, təşvişə salmaq. *Bu hal o qadını daha artıq müztərib edəcəkdir*. S.Hüseyn. **Müztərib olmaq** – iztirab keçirmək, rahatsız olmaq, narahat olmaq, təşvişə düşmək. *Münəvvər xanım da təhsildən qalıb, .. yoldaşları yadına düşüb, qayət müztərib olmuşdu.* M.S.Ordubadi.

**MÜZÜRR** *sif.* [*ər.*] Zərərli, ziyan verən, ziyankar, zərər verən, zərəri toxunan. *Müzürr adam*. – [Mirzə Mustafa] *hiyləgər, mərdimazar və Nikolay zamanından bizə irs qalan şeytanların və müzürr ünsürlərin birisi idi*. E.Sultanov. *Hələ bəziləri* [Naşad əfəndinin] *alçaq, müzürr bir şəxsiyyət olduğunu söyləyirdilər.* S.Hüseyn. // Eyni mənada həşərat və bitkilər haqqında.

# Nn

**N** 1. Azərbaycan əlifbasının iyirminci hərfi. bax **en**.

2. Adı çəkilmək istənilməyən yerə, hərbi hissəyə işarədir. *N. şəhərində yaşamaq. N. hərbi hissəsi. – Mən N. qəzasında pristav idim. Qılıncımın dalı da kəsirdi, qabağı da.* Ə.Haqverdiyev. *Batalyonun qarşısında duran vəzifə N. təpəsini tutmaqdan .. ibarətdi.* Ə.Vəliyev.

**na**... [*fars.*] Sözlərin (əsasən isimlərin və sifətlərin) əvvəlinə gətirildikdə inkar və yoxluq mənasında sifət düzəldən və *-sız/-siz, -suz/-süz* mənasını verən şəkilçidir; məs.: naümid, nabələd, nalayiq, naməlum, naəlac və s.

**NAAVAND** *sif.* və *zərf* [*fars.*] Avand olmayan, qolay olmayan, qolaysız. ☐ **Naavand düşmək (olmaq)** – tərs gəlmək, düz gəlməmək, avand olmamaq. *İş naavand düşəndə, palta da diş çıxardar*. (Ata. sözü).

**NABALİĞ** *sif.* [*fars.* na... və *ər.* baliğ] *köhn.* Həddi-büluğa çatmamış. [Heydər bəy Təkəzə:] *Ərin uşaq deyildi, nabaliğ deyildi, biz onu tovlayıb aparaydıq!* M.F.Axundzadə. *Tifli-nabaliğ ikən məktəbə etdikdə davam; Sən təcəlla eləyib qəlbimə qıldın ilham.* A.Səhhət. [Kəblə Rəcəbəli:] *Bəli! Nabaliğ uşaq öz təklifini anlamaz*. Ə.Haqverdiyev.

**NABAT** *is.* [*ər.*] Meyvə şirəsilə qənd qarışığından hazırlanan şəffaf kristallik şirni növü. *Məşədi Hüseyn müştəriyə nabatı verəndən sonra Kərbəlayı Rzadan kağızı aldı..* C.Məmmədquluzadə. // *məc.* Çox şirin şey haqqında. *Ey yanağı lalə, ləbləri püstə; Ağzı nabat, şəkkər zəban, bəri bax!* M.P.Vaqif. *Hər kəlmən şərbətdir, dodağın nabat; Haq səni göndərib aləmə sovqat.* (Qoşma).

**NABƏCA** *sif.* və *zərf* [*fars.*] *köhn.* Yersiz, münasibətsiz. *Nabəca söz. Nabəca fikir. Nabəca hərəkət etmək. – Yox, əbəs fikirdir, xətadır bu; Nabəca, həm də narəvadır bu.* A.Səhhət.

**NABƏKAR** *sif.* və *is.* [*fars.*] *köhn.* 1. İşə yaramayan, boş.

2. Mərdimazar, yaramaz, alçaq. *Nabəkar adam. – Bu şəhri-Qəzvində bir nəfər nabəkar peyda olubdur*. M.F.Axundzadə. *Düşeydi daş o günə kim, qəzet-məzet sözü çıxdı; Qəzet işin törədən nabəkarə lənət olaydı!* M.Ə.Sabir.

**NABƏLƏD** *sif.* və *is.* [*fars.* na... və *ər.* bələd] 1. Bələd olmayan, tanımayan, başqa yerdən gəlmiş. *Nabələd kor olar*. (Məsəl). [Qəhrəman:] *Qardaş, bunlar hər kəsdisə nabələd adama oxşayırlar*. C.Məmmədquluzadə. *Veys də, Zeynal və o biri üç nəfər də bura nabələd adam deyildilər.* Ə.Əbülhəsən. ☐ **Nabələd olmaq** – bələd olmamaq, bilməmək, tanımamaq. *Həcər Qaradağ ətəklərinə nabələd olduğundan bir baş üzüaşağı enmiş, .. bura ilə irəliləmişdi*. S.Rəhimov. *Onun yerli olmadığını, yerli məişət və adətlərə nabələd olduğunu zənn etmişdim*. Mir Cəlal.

2. Tanış olmayan, yad, özgə. [Keşikçi:] *Vallah, paşa sağ olsun, kövşəndə üç nabələd adam var*. "Koroğlu". *Yetişmiş qızı olan bir ailəyə nabələd bir arvadın gəlib bəhanə ilə soxulması ev adamını şəkkə salardı*. R.Əfəndiyev.

3. Hələ öyrəşməmiş, vərdiş olmamış, alışmamış. *İşə nabələddir. Hələ mühitə öyrənməyib, nabələddir*.

**NABƏLƏDLİK** *is.* Bir yerə, adama, işə bələd olmayan adamın hal və vəziyyəti. [Rübabə] *nabələdliyindən necə hərəkət etmək lazım olduğunu kəsdirə bilmirdi.* Mir Cəlal. *Savalan qadınların bu işə nabələdliklərini yaddan çıxarmırdı.* Ə.Vəliyev.

**NABUD** *sif.* [*fars.*] *köhn.* Olmayan, mövcud olmayan. *Qüvvətin varsa, yaşarsan məsud; Yoxsa, şəksiz, olacaqsan nabud.* A.Səhhət.

**NACAQ** *is.* 1. Enliağızlı, qısasaplı balta. *Necə oldusa .. ustanın əlindən yekə nacaq sürüşüb dənizə düşdü*. M.Hüseyn.

2. Dərvişlərin əllərində gəzdirdikləri buna oxşar əl ağacı. *Padşahla vəzir, hərəsi əlinə bir nacaq, bir kəşkül alıb, düşdülər İsfahan şəhərinə.* (Nağıl). [Dərvişlərin] *çiyinlərində tutduğu və əllərində oynatdığı nacaq və təbərzinlər bir meşə mənzərəsi təşkil edirdi.* M.S.Ordubadi.

**NACİNS** *sif.* [*fars.* na... və *ər.* cins] 1. Cinsi təmiz olmayan, cinsi pozuq; cinssiz. *Nacins qarpızın toxumu çox olar*. (Ata. sözü).

2. Alçaq, nanəcib, rəzil. [Qətibə:] *Nacins qız öz sevgilisini öldürmək istəmədiyi üçün oğlu ölmüş ana kimi hönkürtmə vurub ağlamaqdadır.* M.S.Ordubadi. // Çox pis. [Salman:] *..Qızdırma çox nacins şeydir.* H.Seyidbəyli.

**NACİNSLİK** *is.* Alçaqlıq, nanəciblik, rəzillik. [Nəcəfalı Qarakişiyə:] *Elə nacinsliyin, bax, burda da üzə çıxdı.* B.Bayramov.

**NAÇAQ** *sif.* [*fars.*] bax **nasaz** 1-ci mənada. *Neçə ildir naçağam. – Qarınqulu yemәkdə qoçaq olar, köməkdə naçaq.* (Məsəl). [Tarverdi:] *..Mən iki aydır azarlıyam, üç ildir naçağam!* M.F.Axundzadə. *Bir gün sağ olursan, yeddi gün naçaq; Övrətlər bağrını üzər, ağlarsan.* M.V.Vidadi.

**NAÇAQLAMA** "Naçaqlamaq"dan *f.is.*

**NAÇAQLAMAQ** *f.* Xəstələnmək, azarlamaq. *Gecə Şeyxin yanından mürəxxəs olandan sonra, eşşək səhrada naçaqlayıb vəfat elədi.* E.Sultanov.

**NAÇAQLIQ** bax **nasazlıq** 1-ci mənada.

**NAÇÁLNİK** *is.* [*rus.* начальник] 1. Bir idarəyə, müəssisəyə rəhbərlik edən vəzifəli şəxs; müdir, rəis. *Nikolay hospital naçalnikinə raport yazdı.* Ə.Əbülhəsən. // Belə şəxslərə müraciət. [Usta Xəlilova:] *Xoş gördük, yoldaş naçalnik!* M.Hüseyn. [Kişi:] *Belədir, naçalnik! – deyə çeşməyini alnına qaldırıb başını şübhə ilə buladı.* S.Rəhimov.

2. İnqilabdan əvvəl: polis, jandarm rəisi. [Pirverdi bəy Kabla Qulamalıya:] *Bu saat oğlun Mustafanı get, gətir cənab nəçərnikin hüzuruna!* C.Məmmədquluzadə. *Samovar üstə çaynik; Dostum olsun uryadnik; Dur, şikayətə gedək; Divan qursun naçalnik.* Ə.Cavad.

**NAÇAR** *sif.* və *zərf* [*fars.*] Çarəsiz, əlacsız, naəlac. [Yusif şah] *naçar ümuri-səltənətin icrasına iqdam etdi.* M.F.Axundzadə. *Aslan isə naçar öz qardaşını götürüb, bir balaca ev tutub orada sakin oldu.* C.Cabbarlı. ☐ **Naçar qalmaq (dayanmaq)** – əlacsız qalmaq, çarəsiz qalmaq, naəlac qalmaq, heç bir şeyə, yerə ümidi gəlməmək. *Usta baxdı ki, Alı kişini aldada bilməyəcək, axırda naçar qalıb onun öz qılıncını özünə verdi.* "Koroğlu". *Axacaq ürəyə, idraka işıq; Bəs niyə nigaran, naçar qalmışıq?* Şəhriyar.

**NAÇARLIQ** *dan. zərf* Çarəsizlikdən, əlacsızlıqdan, məcburiyyət qarşısında. [Ağa Məhəmməd şah Qacar:] *Naçarlıqdan itaətə gələn düşmənlə müdara etmək aqil iş deyil. Elə düşmənin bilmərrə kökünü kəsmək gərək.* Ə.Haqverdiyev.

**NAÇİZ** *sif.* [*fars.*] *köhn.* 1. Heç nəsiz.

2. Heç dərəcəsində olan, lap az.

3. Heç bir əhəmiyyəti olmayan.

**NADAN** *sif.* [*fars.*] 1. Cahil, avam, biliksiz, geridə qalmış, məlumatsız. *Nadan adam. Nadanın biridir. – Ağıllı düşmən nadan dostdan yaxşıdır.* (Ata. sözü). *Ey nadan mollaların sözünə qulaq asıb, məndən bir neçə günlüyə üz çevirən camaat!* C.Məmmədquluzadə. // İs. mənasında. *Sənə Vaqif kimi dərd bilən gərək; Layiq görməm hər nadanı mən sənə.* M.P.Vaqif. *Mən Zakirəm, budur sözüm, söhbətim; Nadan ilə hərgiz olmaz ülfətim.* Q.Zakir. *Fikrimi verməm əbəs, siz kibi nadanlara; Sövq edəsiz oğlumu bir para hədyanlara.* M.Ə.Sabir.

2. Xəbərsiz, bixəbər, qafil. [Həcər:] *Özünü tez yetir, ay nadan Nəbi! Tüfəngi havada oynadan Nəbi!* "Qaçaq Nəbi".

3. Öz həddini bilməyən; qaba, kobud, qanmaz. *Nadan adam. Nadan* (z.) *hərəkət etmək.*

**NADANLIQ** *is.* Cahillik, avamlıq, gerilik, biliksizlik, mədəniyyətsizlik, cəhalət. *Görünür, bu da bir siyasətdir, – deyə* [Səməd] *öz nadanlığından və bu cür nazik mətləbi belə gec düşündüyündən öz-özünə acıqlandı.* B.Talıblı. *Bu gün bütün yamanlıqlar qolu bağlı; Bu gün bütün nadanlıqlar qolu bağlı.* M.Araz.

**NADÉL** [*rus.*] *tar.* 1917-ci il inqilabından qabaq Rusiyada: kənd icmasında hər bir kəndli ailəsinin istifadəsinə verilmək üçün ayrılan kiçik torpaq hissəsi; kəsik. *İskəndərin atası əkinçi idi, 1-2 xalvar əlində nadel torpağı, qapısında iki boyun, yəni bir cüt öküzü, iki inəyi, 10-15 qoyun-keçisi, 6 da arı pətəyi var idi.* E.Sultanov. [Kəndlilər] *axırda öz fikirlərini padşaha yazdılar. Padşah kəndlilərin hərəsinə bir şırım nadel yer verdi.* "Qatır Məmməd".

**NADFİL** *is.* Xırda dişləri (kərtmələri) olan kiçik yegə.

**NADİDƏ** *sif.* [*fars.*] *köhn.* 1. Görünməmiş, misilsiz, bərabəri olmayan.

2. Qiymətli, az tapılan, az ələ düşən.

**NADİNC** *sif.* 1. Dəcəl, şuluq, dinc oturmayan. *Nadinc qız. – Çünki yazıq Cəmil doğrusu çox nadinc idi*. C.Məmmədquluzadə. *Nadinc uşaqlar .. bağırışırdılar: – Molla Qasım, qaç, xortdan gəldi*. S.S.Axundov.

2. *məc.* Dinc oturmayan, ona-buna sataşan, araqarışdıran, pozğunluq salan, fitnə törədən; təhrikçi. [Hacı Nuru:] *Ümənayi-dövləti təqsirlidən, təqsirsizdən şikayət etmək ilə təngə gətirdin. Axırda nadinc adam qələminə getdin.* M.F.Axundzadə. [Təbrizdə] *nadinc adamların sayı çoxalır*(*dı*). M.S.Ordubadi.

3. *məc.* Sakitlik bilməyən, coşqun. *Xəzərin nadinc dalğaları .. o tənha buruq ətrafında rəqs edir..* Ə.Məmmədxanlı.

**NADİNCLİK** *is.* 1. Dəcəllik, şuluqluq. *Nadinclik etmək. – O, öz nadincliyindən zövq alan bir dəcəl kimi şən-şən gülümsəyir.* M.Rzaquluzadə.

2. Dinc oturmama, rahat oturmama, ara qarışdırma. *Hökumət rəiyyətin nadincini sevir, çünki onlar cəriməni ancaq nadinc adamlardan ala bilərlər. Bizim kənddə isə nadinclik yoxdur.* M.S.Ordubadi.

**NADİR** *sif.* [*ər.*] Aztapılan, az təsadüf edilən, az ələ düşən. *Nadir kitab. Nadir əlyazması. Nadir şey. – Səxavət olmayan kəsdə şücaət feli nadirdir; Kərəmsiz kimsəni hər yerdə gördüm, bihünər gördüm*. M.V.Vidadi. ☐ **Nadir hallarda** – arabir, hərdənbir, təsadüfən, təkdənbir, çox seyrək, az. *Tərlan adətən nadir hallarda əsəbiləşirdi*. M.Hüseyn. “*Baş üstə*” *sözünü nadir hallarda dilinə gətirən Rüstəm kişi bu dəfə ürəyindən keçsə də demədi*.. M.İbrahimov.

**NADİRÜLVÜCUD** *sif.* [*ər.*] *köhn.* Müstəsna, çox az tapılan, nadir hallarda təsadüf edilə bilən. *Nadirülvücud şəxs. – Müsəlmanlar arasında belə bir abdar əşar müsənnifləri nadirülvücuddur*. F.Köçərli.

**NADÜRÜST** *sif.* və *is.* [*fars.*] Fırıldaqçı, kələkbaz, hiyləbaz, əliəyri, cüvəllağı, haramzadə. [Gileygüzarov:] *Arvad, gələn dəfə bu nadürüstü çağırsaq hər ikimizin atasına lənət!* S.Rüstəm. *Nərgizə baxıram; Mənə kəm baxan; Nadürüst gözləri unutmaq üçün...* B.Vahabzadə. // Söyüş məqamında (əsasən kişilər haqqında).

**NADÜRÜSTLÜK** *is.* Fırıldaqçılıq, hiyləbazlıq, əliəyrilik, haramzadəlik. [Cənnətəli ağa:] *Qırışmal oğlu, nadürüstlük sənin özündəndir. Papağın yırtılar birini də allam..* N.Vəzirov.

**NAEHMAL** [*fars.* na... və *ər.* ehmal] b a x **ehmalsız**. *Naehmal hərəkət. Naehmal danışıq*.

**NAƏHL** *sif.* [*fars.* na... və *ər.* əhl] Ləyaqətsiz, yaramaz, tərbiyəsiz, qanmaz. *Naəhl adam*. // İs. mənasında. *Danışdın qaş-göz ilə hər ötən naəhl ilə, zalım!* Q.Zakir. *Naəhl olana mətləbi qandırmaq olurmu?* M.Ə.Sabir. *Nakəslər və naəhllər ilə dəxi dostluq etmək rəva deyil.* F.Köçərli.

**NAƏHLLİK** *is.* Ləyaqətsizlik, yaramazlıq, rəzillik, alçaqlıq, nanəciblik.

**NAƏLAC** [*fars.* na... və *ər.* əlac] 1. B a x **əlacsız** 2-ci mənada. [İmran:] *Bu gecəliyə qonaq olmağı rica etdi, naəlac qalıb razı oldum.* S.S.Axundov. *İnsanın sevgilisi, istəklisi, məşuqəsi əğyar ilə oturub, oynayıb gülsün, insan özü isə naəlac* (z.) *kənarda oturub baxsın*. C.Cabbarlı. [Eyvaz:] *Mən naəlac qalaraq ayağa durdum*. İ.Əfəndiyev.

2. *İs. mənasında*. Yazıq, fağır, əlacsız, əlsiz-ayaqsız adam. *..Dünyada hər bir şeydən gözəlraq naəlaclara kömək etməkdir.* N.Vəzirov.

**NAƏLACLIQ** b a x **əlacsızlıq**. [Əsəd] *naəlaclıqdan yardım arayan adam kimi .. məktəb xidmətçisinə müraciət etdi.* B.Talıblı.

**NAFTALÁN** *is.* [*yun.*] Yumşaq kütlə halında olan, dezinfeksiyaedici, ağrıkəsici dərman preparatı.

**NAFTALÍN** [*yun.* naphtha – neft] Kəskin iyli ağ kristallik maddə (texnikada, habelə yun və dərini güvədən qorumaq üçün işlədilir). *Naftalin səpmək. Naftalin iyi.*

◊ **Naftalin iyi vermək** – köhnəlmiş, vaxtı keçmiş şey haqqında. [Veysəl Zinyətə:] *Yaxşı ki, naftalin iyi verən bu sözləri yadınızdan çıxarmamısınız*. B.Bayramov. **Naftalinə qoymaq** – köhnəlmiş, vaxtı keçmiş şey haqqında.

**NAFTALİNLƏMƏ** “Naftalinləmək”dən *f.is.*

**NAFTALİNLƏMƏK** *f.* Güvədən qorumaq üçün naftalin səpmək, naftalin tökmək. [Musanın nəvəsi] *köhnə kostyumlarını*

*naftalinləyib sandığa yığdı.* Qantəmir. [Adil:] *Bir neçə gündən sonra atam anamın paltarını naftalinləyib sandığa yığdı.* B.Bayramov.

**NAFTALİNLƏNMƏ** "Naftalinlənmək"-dən *f.is.*

**NAFTALİNLƏNMƏK** *məch.* Güvədən qorumaq üçün naftalin səpilmək, naftalin tökülmək. *Xalçalar naftalinlənib.*

**NAFTALİNLİ** *sif.* Naftalin səpilmiş, naftalin tökülmüş, naftalinə qoyulmuş. *Naftalinli palto.*

**NAFTÓL** [*yun.* naphtha – neft və *lat.* ol(eum) – yağ] Naftalindən alınan və boya rəngləyici maddəsi kimi istifadə edilən kimyəvi birləşmə.

**NAGAH** *zərf* [*fars.*] Qəfildən, birdən, gözlənilmədən, xəbərsiz, ansızın. *Nagah gözəl bir quş uçub gəldi sədayə; Guya dedi; səbr eylə, a Səhhət, bu bəlayə.* A.Səhhət. [Xortdan:] *Nagah xəyalimə cəhənnəm düşdü.* Ə.Haqverdiyev. *Yolçular çarəsiz qalıb nagah; İki-bir, üç-bir oldular həmrah.* H.Cavid.

**NAGAHAN** [*fars.*] 1. B a x **nagahani**. *..Orada cavanlar nagahan bəlalara düçar olurlar..* C.Məmmədquluzadə. *..Hələ ömrümdə belə nagahan şey görməmişəm.* S.Rəhimov.

2. *zərf* Gözlənmədən, birdən-birə, qəfildən, xəbərsiz. *Nagahan küçədə ucaldı səda; Vur-haray düşdü, qopdu bir qovğa.* M.Ə.Sabir. [Şeyx Hadi:] *Nagahan başlayıb vəba, taun; Sardı ətrafı, xəlqi etdi zəbun.* H.Cavid. *Günlərin birində öz evində yaşadığı vaxtda, nagahan, Həsən yenə də azarladı..* B.Talıblı.

**NAGAHANİ** *sif.* və *zərf* Gözlənilməyən, gözlənilməz, naqafil. *Nagahani dərd. – Müəllim kəndə vaxtından əvvəl qayıtdı. Onun belə gəlişi Telli üçün nagahani idi.* S.Hüseyn. *..Nagahani bir səs onu bu xəyaldan ayırdı.* M.İbrahimov. [Vahid:] *Yenə də axırıncı sözlər* [kişinin] *ağzından nagahani çıxdı.* B.Bayramov.

**NAGAHANİLİK** *is.* Gözlənilməzlik, naqafillik, ansızlıq.

**NAGAHDAN, NAGAHANDAN** *zərf* Gözlənmədən, qəfildən, bilmədən, təsadüfən, birdən. *Nagahdan gözlərim görəndə səni; Qalmadı canımda ixtiyar, gəlin!* M.P.Vaqif. *Nagahandan düşdüm belə dərdə mən; Necə çəkim eşq üzünə pərdə mən.* Aşıq Pəri.

**NAGÜMAN** *sif.* [*fars.*] Gümanı olmayan, inanmayan, ümidsiz. *Nagümanam mən bu dərddən sağalım; Təbib birdir, dərd min birdir, yarə yüz.* Aşıq Qurbani. □ **Nagüman etmək (eləmək)** – ümidsiz etmək, arzusunu ürəyində qoymaq. *Sapan tək atma məni; Yadlara satma məni; Yolunu gözləyirəm; Nagüman etmə məni.* (Bayatı).

**NAGÜMANLIQ** *is.* Gümansızlıq, inamsızlıq, ümidsizlik.

**NAGÜVARA** *sif.* və *zərf* [*fars.*] *köhn.* Qeyri-düzgün; zor, ağır, çətin. *Zeynəbə Xudayar bəyin iri burnuna və kifir sifətinə baxıb, ona ər demək nagüvara və naxoş görünürdü.* C.Məmmədquluzadə.

**NAĞARA** *is.* Hər iki üzünə dəri çəkilmiş silindrik gövdəli zərb musiqi aləti. *Nağara çalmaq. – Kəndin yuxarı tərəfində qarazurna mələyir, nağara gumbuldayır, tar, qaval səslənir, kim isə şirin-şirin oxuyurdu.* Ə.Vəliyev. □ **Nağara ağacı** – nağara çalmaq üçün xüsusi şəkildə düzəldilmiş iki ağacdan hər biri. ◊ **Toydan sonra nağara** – b a x **toy**. *Əbədilik bir ağrı tək; Sonra sizi yandıracaq, göynədəcək; Toydan sonra bu nağara; Kimə gərək; Nəyə gərək?* B.Vahabzadə.

**NAĞARAÇALAN, NAĞARAÇI** *is.* Nağara çalan çalğıçı. [Cənnətəli ağa:] *Qız uşağını öz başına qoysan ya aşığa gedər, ya nağaraçıya.* N.Vəzirov.

**NAĞARAÇILIQ** *is.* Nağaraçının sənəti, peşəsi. *Nağaraçılıq etmək.*

**NAĞD** *is.* [*ər.*] 1. Pul (hər şəkildə olur olsun). [Hacı Saleh:] *Pul istəyir, deyir pulu nağd verin.* S.Rəhman. □ **Nağd etmək (eləmək)** – hər hansı bir şeyi satıb pul etmək (eləmək).

2. Puldan ibarət var, dövlət, sərvət. *Min manat nağdı var.* // *Sif. mənasında.* Hazırda mövcud olan, əldə olan, üzdə olan. *Bir nəfər Hacının əqrəbasından getdiyi Kərbəlaya and içib, Hacı Səlimin bankda on altı milyon nağd pulunun yatdığını söyləyir.* Ə.Haqverdiyev. // Məc. mənada. *Nağd iyirmi adam var.*

3. *məc. dan.* Mütləq, sözsüz, şəksiz, şübhəsiz, yəqin.

◊ **Nağd eləmək** *dan.* – yəqin etmək (bəzən istehza ilə deyilir). *Ezamiyyətə getməyi nağd eləmək.* **Nağdı qoyub nisyə dalınca**

**getmək (qaçmaq)** – yerinə yetirilməsi çətin olan bir işdən, şeydən yapışmaq. *Bu nəqdi qoyub nisyə dalınca nə gedim mən.* S.Ə.Şirvani. **Nağdı nisyəyə satmaq** – b a x **nağdı qoyub nisyə dalınca getmək (qaçmaq)**. *Axmaq o adamdır ki, nağdı nisyəyə satır.* S.Hüseyn.

**NAĞIL** *is.* [*ər.* nəql] Adətən əfsanəvi, fantastik qüvvələrin iştirakı ilə cərəyan edən uydurma hadisələr və şəxslər haqqında hekayə, rəvayət (şifahi xalq yaradıcılığının bir növü). *Azərbaycan nağılları. Sehirli nağıllar. – Şirin-şirin nənəm nağıllar deyir; Mənim yuxum qaçır, nənəm əsnəyir.* A.Səhhət. *Yusif əmi hər gecə bizə şirin-şirin nağıllar danışar, çox qəribə tapmacalar deyərdi.* A.Şaiq. ☐ **Nağıl etmək (eləmək)** – şifahi surətdə bildirmək, danışmaq. [İskəndər:] *Ey mənim gözəl Nazlı bacım.. Mənim yanıma gəlmirsən ki, gəzdiyim şəhərlərdən sənə nağıl eləyim.* C.Məmmədquluzadə. [Mehriban] *dörd-beş illik həyatını, son günədək başına gələn hadisələrin hamısını ona nağıl etdi.* S.Hüseyn. **Nağıl kimi** – əslən olmayan, uydurma, xəyali bir şey haqqında. *Yaxşı və dəbdəbəli toy qıza nağıl kimi maraqlı görünürdü.* M.İbrahimov.

◊ **Nağıl açmaq** – bir hadisə, iş haqqında uzun-uzadı danışmaq. *Min də nağıl aç, birin aldatmayır; Keçdi gecə, mətləbə əl çatmayır..* M.Ə.Sabir. [Kərim kişi:] *Yaxşı, nağıl açma, de görüm nə istəyirsən?* İ.Şıxlı.

**NAĞILBAŞI** *is. folk.* Dinləyiciləri maraqlandırmaq, güldürmək üçün nağılların əvvəlində söylənən yüngül məzmunlu müqəddimə, giriş; məsələn, Hamam hamam içində; Xəlbir saman içində; Dəvə dəlləklik elər; Köhnə hamam içində və s.

**NAĞILBAZ** *is.* [*ər.* nəql və *fars.* ...baz] Nağıl danışmağı, yaxud nağıla qulaq asmağı çox sevən adam. *İkinci gün* [Sabirin] *yadına .. nağılbaz qocalar düşürdü.* S.Rəhimov.

**NAĞILBAZLIQ** *is.* Nağıl danışmağı, yaxud nağıla qulaq asmağı sevmə. *Bağır istədi desin ki, oxuma, səhər-səhər nə nağılbazlıqdı, nağılı gecələr danışarlar, .. amma deməyə macal tapmadı, çünki Nurcabbar artıq ayaq üstə idi.* İ.Məlikzadə.

**NAĞILÇI** *is.* 1. Çox nağıl bilən və onları məharətlə danışmağı bacaran adam. *Nağılı nağılçıdan öyrən.* (Ata. sözü). [Molla Abbas:] *Necə nağıl de? Nə zəvzək danışırsan?.. Mən vaizəm, yoxsa nağılçıyam ki, sizə nağıl deyəm?* C.Məmmədquluzadə. [Əsgər] *nağılçı deyil. O sənə Leyli və Məcnun məsələsini misal göstərdi.* M.S.Ordubadi.

2. Çoxdanışan, çərənçi, boşboğaz, naqqal, lağlağı; uydurmaçı. [Məşədi Rüstəm:] *Bizə nə versələr, ikiqat qiymətini alsınlar. Sən nə nağılçı kişisən.* R.Əfəndiyev. *Danabaşlılar* [Xəlili] "*nağılçı*", *yaxud* "*qəzetçi Xəlil*" *adlandırırlar.* M.İbrahimov.

**NAĞILÇILIQ** *is.* Uzunçuluq, sözçülük. *Yazıçı .. özbaşına təsviri istədiyi yerdə kəssə və ya əlavə edib uzatsa, nağılçılıq meydana çıxar.* M.İbrahimov.

**NAĞILVARİ** *zərf* və *sif.* Üslub və məzmun etibarilə nağıl kimi olan, nağıla oxşar. *Nağılvari danışmaq. Nağılvari yazmaq.*

**NAHAQ** *sif.* [*fars.* na... və *ər.* həqq] 1. Haqsız, ədalətsiz, haqq və insafa müğayir; qanunsuz. [Yusif şah:] *Hakimi-vilayətlərə mənim tərəfimdən elan edərsiniz ki, Allahdan qorxsunlar, nahaq iş tutmasınlar..* M.F.Axundzadə.

2. Əbəs, yersiz, boş, bihudə. *Nahaq iş. – Nə layiqdir sənin kimi sərvərə; Bais ola belə nahaq işlərə.* Q.Zakir. *Nahaq söz od vurar qəlbə, fəqət haq söz keçər daşdan.* S.Vurğun. ☐ **Nahaq yerə** – boş yerə, əbəs, heç bir ehtiyac olmadan. *Nahaq yerə gəlmək. Nahaq yerə cəncəl işə qarışdı.* – [İbrahim bəy:] *Mən bilmirəm, o kimə yamanlıq etmişdi, biçarə lap nahaq yerə bədbəxt oldu.* N.Vəzirov. [Mirzə Cavad:] *Ay balam, nahaq yerə bu əziyyət nə lazımdır, niyə özünü incidirsən?* Ə.Haqverdiyev.

**NAHAQCA** *zərf* Nahaq yerə, əbəs yerə. *Qəlbini incitməsin nahaqca vicdanın sənin!* Ə.Nəzmi.

**NAHAQDAN** *zərf* Heç bir əsas və dəlil olmadan, haqsız olaraq. *Nahaqdan işə düşmək. – Məsləhətçin eləyiblər neçə əşxası qaçaq; Neçə kəs var ki, nahaqdan olubdur dustaq..* S.Ə.Şirvani. // Nahaq yerə, əbəs yerə. [Rəhman:] *Lap nahaqdan ləşkəri göndərdiniz belə uzaq.* Ü.Hacıbəyov.

**NAHAQLIQ** *is.* Haqsızlıq, ədalətsizlik, insafsızlıq. [Məhərrəm:] [İki cavanı zor ilə

ayırmaq] *ədalətsizlik deyilmi? Nahaqlıq deyilmi.* C.Cabbarlı.

**NAHAMAR** *sif.* [*fars.* nahəmvar] 1. Kələ-kötür, girintili-çıxıntılı, çala-çuxur, hamar olmayan. *Nahamar yer. Nahamar taxta. – Sərbəndin nahamar olması* [ustanı] *ayağının da birini qaldırıb havada fırlamağa məcbur etdi*. Çəmənzəminli. *Nahamar yolda maşın atılıb-düşəndə az qala* [Firəngizin] *beyni tərpənirdi*. B.Bayramov.

2. *məc.* Kobud, qaba, yöndəmsiz, biçimsiz. *Nahamar adam. – İbrahim başını qaldırıb baxanda gördü, bu bir nahamar ifritədir ki, alt dodağı yer süpürür, üst dodağı göy süpürür.* (Nağıl).

**NAHAMARLIQ** *is.* Nahamar şeyin halı. *Sahənin nahamarlığını düzəltmək.*

**NAHAMVAR** *klas.* bax **nahamar**.

**NAHAR** *is.* [*ər.* nəhar] 1. Günorta yeməyi. *Nahar etmək. – Mirzə iştahasız nahar yeyib yatmaq istədi.* Ə.Haqverdiyev. *Hədiyyə naharını təzəcə bitirmişdi ki, qapıda maşın səsləndi.* Mir Cəlal. // Bu məqsədlə hazırlanmış yemək, xörək. *Nahar hazırlamaq. – ..Qız nahar bişirmək üçün ərzaq almağa getdi.* M.S.Ordubadi.

2. Həmin xörək yeyilən vaxt; günorta. *Nahara qədər işləmək. – Səlimə qadınlar klubunda nahardan axşama qədər çalışır.* H.Nəzərli. *Əfruz bacı bir gün nahardan sonra Mədədi yaxaladı*. S.Rəhimov.

**NAHARLIQ** *sif.* Nahara məxsus, nahara aid, nahar üçün. *Naharlıq ərzaq tədarük etmək*. – [Cəfər:] *Qardaş, indi növbətdən çıxa bilərsən, iki naharlıq biletimiz var.* Çəmənzəminli.

**NAHARSIZ** *zərf* Yeməksiz, ac. *Naharsız saxlamaq*. – [Qaraca qız:] *..Anam sağ olanda məni də naharsız qoyardı.* S.S.Axundov.

**NAHİYƏ** *is.* [*ər.*] 1. 1917-ci il inqilabından əvvəl və inqilabın ilk dövründə qəza tərkibinə daxil olan inzibati-ərazi vahidi; rayon. [Kəndli:] *Dedim heç belə bir iş olmaz, getdim nahiyəyə, ispolkoma dedim, dedi ərizə ver*. T.Ş.Simurq. [Bəhram:] *O vaxt bizim nahiyənin pristavı Navedski adında çox rəhmsiz və əclaf bir adam idi.* Ə.Vəliyev.

2. İnsan və heyvan bədənində hər hansı bir daxili orqanın yerləşdiyi sahə, yer. *Ürək nahiyəsi. Döş nahiyəsi.*

**NAX** *is.* Qafqaz qrupuna daxil olan dillərdən biri.

**NAXA** bax **naqqa**.

**NAXAH** [*fars.*] *köhn.* İstəmədən, istəməyərək, istəməyə-istəməyə. *Camaatla xan danışan əsnada Allahqulu kənarda durub dinməz qulaq asır. Xan ona tərəf baxanda naxahi baş əyir.* Ə.Haqverdiyev.

**NAXƏLƏF** *sif.* [*fars.* na... və *ər.* xələf] Əcdadına, əslinə, əsli-nəsəbinə layiq olmayan. *Naxələf övlad. – Cahıllıq zamanı keçibdir əgər; Yenə yüz naxələf oğlana dəyər.* Q.Zakir. *Ax, naxələf oğlum, nə yaman eşqə düşübsən; Ey kaş, usanaydın!* M.Ə.Sabir. // İs. mənasında. *Sanki bu sözlərin ixtiyarı oğlunda, o naxələfin əlində idi*. Mir Cəlal. *Aşıq sözü şirin olur, o çalsın; Naxələfi doğan ana qocalsın.* R.Rza. // Çörəkitirən, nankor, naşükür. ☐ **Naxələf olmaq (çıxmaq)** – nankor çıxmaq, yaxşılığı itirmək, çörək itirmək, nanəcib çıxmaq. *El bilir, uşaqlıqdan o, naxələf olmayıb.* S.Rüstəm. [Pərzad:] *Məni öldürün, mən naxələf oldum*.. Mir Cəlal. [Bayramın] *kürəkəni naxələf çıxdı*. Ə.Vəliyev.

**NAXƏLƏFLİK** *is.* Ata-anaya qarşı nankorluq; naşükürlük. *Ürəyim ona sıxılırdı ki, üç uşağımın biri başlayıb naxələflik göstərməyə.* C.Məmmədquluzadə. // Nanəciblik, rəzillik, pislik, yamanlıq. [Göyçək Fərruxa:] *Bizdə nə naxələflik görmüşdün?* B.Bayramov.

**NAXIR** *is.* Bir yerdə otlayan mal-qara sürüsü. *..Şiddətli çovğun başladığı üçün naxır çöldən tez qayıtdı*. S.Hüseyn. *Naxır tozlu yollardan axışıb gəlirdi*. Mir Cəlal. ☐ **Naxıra getmək** – naxır otarmaq, naxırçılıq etmək. *..Mövlamverdi kişi Nikolay vaxtı Güneyqışlaqda ən yoxsul adam olub naxıra gedərmiş*. İ.Əfəndiyev.

◊ **Bir naxır** *dan*. – olduqca çox, sayca çoxlu. [İmamqulu:] *Zarafat deyil, qardaş, bir naxır külfətim var.* N.Vəzirov.

**NAXIRÇILIQ** *is.* Naxırçının işi, peşəsi. *Naxırçılıq etmək.*

**NAXIROTARAN, NAXIRÇI** *is.* Mal-qara otaran, naxıra baxan adam. [Kərbəlayı Məmmədvəli:] *Sən mənə havaxt naxırçı olmusan ki, mənim malımın sayını biləsən, qoçaq!* N.Vəzirov. [Gülsənəm:] *..Ağanın naxırçısı inəyimi damğalayıb bəyin naxırına qatmış.* S.S.Axundov.

**NAXIŞ** *is.* [*ər.* nəqş-dən] 1. Rənglərin, cizgilərin, kölgələrin kombinasiyasından ibarət şəkil, çəki, bəzək və s. *Onun divarları al-əlvan naxış; Əsrdən-əsrə hədiyyə qalmış.* S.Vurğun. *Zərqələmin yadigarı üzərində naxışlar tikilmiş bir yaylıq idi.* Ə.Sadıq. ◻ **Naxış vurmaq (salmaq)** b a x **naxışlamaq**. [Turac:] *Batmış gör necə də qəşəng naxışlar vurub!..* İ.Əfəndiyev. *Şaxta pəncərəyə naxış salanda; Bir böyük heykəlin keçib yanından; Seyr edirəm onu mən heyran-heyran.* N.Rəfibəyli.

2. Kart kağızlarında xal, nişan. ◻ **Naxışı tutmaq** – oyunda və s. əli gətirmək, udmaq.

**naxış-naxış** *sif.* Naxışları olan, naxışlarla bəzəkli, naxışlı. *Naxış-naxış köynək.*

**NAXIŞAÇAN** *is.* Ağac, metal, daş və s. üzərində cürbəcür naxışlar salan, naxışlar həkk edən usta; naxış ustası. // Sif. mənasında. *Naxışaçan usta.*

**NAXIŞÇI** *is.* Naxış vuran, naxış salan usta, naxışaçan.

**NAXIŞLAMA** "Naxışlamaq"dan *f.is.*

**NAXIŞLAMAQ** *f.* 1. Cürbəcür rənglər, boyalar, saplar və s. ilə şeylərin üzərinə naxış salmaq, naxış vurmaq. *Evin divarlarını naxışlamaq. Köynəyin yaxasını naxışlamaq. – Yaylıq, səni yar işlədi; Ətrafını naxışladı..* Aşıq Kərəm.

2. Həkk etmək, qazımaq (ağacda, daşda, qabın üzərində). *..Qabları naxışlamaq, bəzəmək qoca bağbanın böyük qardaşı İbrahim Tahirin peşəsi idi.* S.Rəhimov.

**NAXIŞLANMA** "Naxışlanmaq"dan *f.is.*

**NAXIŞLANMAQ** *məch.* Naxış vurulmaq, naxış salınmaq, naxışla bəzənmək. *Evin divarları naxışlanıb qurtarmışdır.*

**NAXIŞLANMIŞ** *f.sif.* Üzərində naxış açılmış, naxış vurulmuş, naxışla bəzədilmiş; naxışlı. *Naxışlanmış kəlağayı. Naxışlanmış divar.*

**NAXIŞLI** *sif.* 1. Naxış vurulmuş, naxış salınmış, naxışla bəzədilmiş. *Naxışlı dəsmal. Naxışlı qab. Naxışlı mal. – Katib .. bir cüt qırmızı dilim naxışlı çaynik çıxartdı.* S.Rəhimov. *Xalçanın naxışlı yol-yol haşiyələri gözlərdə parıldayırdı.* Mir Cəlal.

2. *məc. dan.* Bəxtli, bəxti yaxşı olam, əli gətirən. *Naxışlı adam.*

**NAXIŞSIZ** *sif.* Naxışı olmayan; saya. *Naxışsız parça. Naxışsız qab.*

**NAXOŞ** *is.* [*fars.*] Xəstə, azarlı. *Bir naxoşun üstə həkim gətirəndə həkim əvvəl yapışır naxoşun nəbzindən..* C.Məmmədquluzadə. [Sultan bəy:] *Nə olub ki, naxoş deyilsən ki?* Ü.Hacıbəyov. // Sif. mənasında. *Naxoş adam.*

◊ **Səndən (sizdən) naxoş** *dan.* – yeməkdən söhbət gedərkən "yerin(iz) məlum" mənasında işlədilən ifadə. *Səndən naxoş, bir kabab yedik. – Uzun qış gecəsi, sizdən naxoş, plovu yemişdik.* Qantəmir.

**NAXOŞLAMA** "Naxoşlamaq"dan *f.is.*

**NAXOŞLAMAQ** *f.* Xəstələnmək, azarlamaq. [İmran:] *Yadındadırmı, anacan, atam bir dəfə naxoşladı..* Ə.Haqverdiyev. [Aydın Səkinəyə:] *Əgər naxoşlayıb eləsən, yanıma gəl.* H.Seyidbəyli.

**NAXOŞLATMA** "Naxoşlatmaq"dan *f.is.*

**NAXOŞLATMAQ** *f.* Xəstələndirmək, azarlatmaq, xəstəliyə salmaq, naxoşlamasına səbəb olmaq. *Uşağı soyuğa verib naxoşlatmaq.* – [Nisə xala:] *Tərli-tərli içəndə su bizə ləzzət verir. Amma sizləri naxoşladır.* Qantəmir.

**NAXOŞLUQ** *is.* Xəstəlik, azarlılıq. *Naxoşluğu uzun çəkmək.* – [Əvvəlinci azarlı:] *..Bu zəhrimar naxoşluq yapışıb yaxamdan.* C.Məmmədquluzadə. [Baxışoğlu Həsən] .. *özünü azardan və naxoşluqdan hifz etməzdi.* B.Talıblı. ◻ **Naxoşluğa salmaq** – b a x **naxoşlatmaq**. *Keyfiyyət Səfərə təsir edib, onu naxoşluğa salır.* Ə.Haqverdiyev.

**NAXÜNƏK** *is.* Birinin üzüyumşaqlığından istifadə edərək şeyini götürmə (adətən **naxünək vurmaq, naxünək etmək** şəklində işlənir). *– Ye bala, ye!.. – deyə Kərbəlayı özü də böyürdən naxünək vurmağa başladı.* M.Hüseyn. *Prokuror formalı bir nəfər naxünək papirosu yandıraraq sözə qarışdı.* "Kirpi".

**NAXÜNƏKÇİ** *is.* Naxünək vurmağı adət etmiş adam. *Naxünəkçinin cibi gen olar.* (Məsəl).

**NAXÜNƏKÇİLİK** *is.* Naxünəkçinin xasiyyəti, sifəti. *Naxünəkçilik eləmək.*

**NAİB** *is.* [*ər.*] *tar.* 1. Böyük bir şəxsin yerini dolandıran şəxs; vəkil, canişin. *Padşahın naibi.*

2. Yerli inzibati idarə rəisi, kənd icması başçısı. *Nahiyə naibi. Qəza naibi. Şəhər naibi. – Keşikçi* [qasidi] *naibin yanına götürdü.* M.S.Ordubadi.

3. Köməkçi, əlaltı. [Xotkar:] *Ondan sonra ya gərək gedib ona nökərdən, naibdən olaq, ya da ki, qaçıb dağlarda, daşlarda qaçaqlıq eləyək.* "Koroğlu". *Hatəm xan nökər, naiblə birlikdə atlanıb, Yədulla xanın malikanəsinə üz qoydular.* S.Rəhimov.

**NAİBLİK** *is.* 1. Naibin işi, vəzifəsi; vəkillik, canişinlik.

2. Naibin idarəsi altında olan yerlər.

**NAİL** [*ər.*]: **nail olmaq** – əldə etmək, müvəffəq olmaq, çatmaq, yetmək. *Məqsədə nail olmaq. İstəyinə nail olmaq*. – [Dərviş:] *Dilədiyimiz arzuya nail olduq*. A.Divanbəyoğlu. *Beləliklə, Naşad əfəndi öz məqsəd və məramına nail olmuş(du*). S.Hüseyn.

**NAİLİYYƏT** *is.* [*ər.*] 1. Hər hansı bir sahədə, işdə əldə edilmiş yaxşı nəticə; müvəffəqiyyət. *Azərbaycan xalqı hər sahədə yeni və böyük nailiyyətlər əldə etmişdir.* M.İbrahimov. [Qurban] *qazdığı hər quyuda .. elm və texnikanın son nailiyyətini cəsarətlə həyata keçirmişdir*. Ə.Sadıq.

2. *köhn.* Əldə etmə, nail olma, istəyinə çatma.

**NAİNSAF** [*fars.* na... və *ər.* insaf] İnsafsız. *Nainsaf qonşular Süleymanın bu qədər zəhmətinə baxmayıb, yenə də onu əvvəlki kimi* "*Süleyman*" *deyə çağırırdılar*. B.Talıblı. // İs. mənasında. *Nainsafın kəli qaçar*. (Ata. sözü). *..Heç bir dəfə də olmuyub ki, bu nainsaflar, heç olmasa tək bircə dəfə bu xəstəlikdən şəfa tapmış olalar.* C.Məmmədquluzadə.

**NAİNSAFLIQ** *is.* İnsafsızlıq. *Nainsaflıq etmək*. – [Ana:] *Hərgah Ülkər qızı aparmaq istəyirsə, üz vurma. Balanı anadan ayırmaq nainsaflıqdır*. Ə.Vəliyev.

**NAKAM** [*fars.*] bax **kamsız**. *Nakam cavan. Nakam ölmək. Nakam məhəbbət*. – [Əbdül:] *Sara da getdi! Yazıq qız, nakam qız! Onun ölümü mənim sinəmə bir dağ çəkdi.* C.Cabbarlı. [Xan] *gözlərini məchul bir nöqtəyə zilləmiş, igid oğlunun nakam taleyini, vəfalı arvadının qara bəxtini düşünürdü..* M.Rzaquluzadə. *Ürəyində sevgisi nakam ölən qızların; Alacağam qanlıdan amansız qisasını.* M.Rahim. ◻ **Nakam qalmaq** – arzusuna çatmamaq, məqsədinə yetməmək, arzusu ürəyində qalmaq. *Arzular, diləklər nakam qalmadı; Çöllər sudan doydu, gözlər işıqdan.* O.Sarıvəlli. **Nakam etmək (qoymaq)** – bədbəxt eləmək, kama yetməyə qoymamaq, arzusunu ürəyində qoymaq. [Nüşabə:] *Bil, sənə casusluq edən bu adam; Çağlayan eşqimi qoymuşdur nakam*. A.Şaiq. **Nakam olmaq** – kama çatmamaq, arzusuna yetməmək, bədbəxt olmaq. *Bir gülən yox bu qayğılı dünyada; Çoxlar nakam olub irməz murada.* H.Cavid.

**NAKAMLIQ** *is.* Kama yetməmə; kamsızlıq. *Olsa nakamlığım gər o pərinin kamı; Dili-divanəni həq dəhrdə nakam eləsin*. S.Ə.Şirvani.

**NAKƏS** *sif.* və *is.* [*fars.*] Şərəfsiz, yaramaz, alçaq, rəzil. *Nakəs adam danışıqnan saz olu; Kərəmdən kəm, səxavətdən az olu.* Aşıq Ələsgər. // İs. mənasında. *Mərdlər ilən gəz ki, vəfadar olur; Nakəslərə yoldaş olan xar olur*. M.V.Vidadi. *Nakəslər və naəhllər ilə dəxi dostluq etmək rəva deyil*. F.Köçərli.

**NAKƏSLİK** *is.* Alçaqlıq, rəzillik, yaramazlıq. *Nakəslik eləmək.*

**NAKİŞİ** *sif.* Namərd, xain. *Nakişi adam*. // İs. mənasında. [Mürsəl:] *İlqarından dönən, andını pozan, verdiyi sözə əməl eləməyən nakişidir!* Ə.Vəliyev.

**NAKİŞİLİK** *is.* Namərdlik, xainlik. *Onda nakişilik olardı, axı, sən Hacı Atakişisən, .. uşaq-muşağa baş qoşmayacaqsan ki.. – deyə Əmir gülümsündü*. Ə.Abasov.

**NAQABİL** *sif.* [*fars.* na... və *ər*. qabil] 1. Nalayiq, yersiz, münasibətsiz. *Müdir cənablarına minnətdar olub, naqabil sözümdən üzr istəyirəm*. Mir Cəlal. [Nənəqızın] *dilinə naqabil kəlmə gəlməz, ağzından tikanlı söz çıxmazdı*. Ə.Vəliyev. // *İs. mənasında*. Nalayiq, ləyaqətsiz adam; qanmaz. *Nə işim var, naqabilə söz deyəm, damağına ya dəyməyə, ya dəyə*. (Məsəl). *Əlli min suxtə, əlli min sail; Əlli min hoqqabazi-naqabil.* S.Ə.Şirvani.

2. İmkansız, mümkün olmayan; çətin, mahal. *O, naqabil bir işdir.*

3. Əxz etməyə, götürməyə qabiliyyəti, istedadı olmayan; qeyri-qabil. *Tərbiyəyə naqabil.*

**NAQAFİL** *sif.* və *zərf* [*fars.* na... və *ər.* qafil] Qəfildən, birdən, nagahan, gözlənilmədən, xəbərsiz. *Naqafil azara düşmək. Naqafil söz demək. Naqafil gəlmək. – Az*

*qalmışdı duram, bir özgə tərəfə üz qoyam, birdən, aha, rəfiqim Rzaqulu bu tərəfdən naqafil çıxdı.* C.Məmmədquluzadə. [Kərbəlayı Rəcəb:] *Balaqardaş zalım oğlu naqafil anbardan çıxdı, ürəyim qopdu.* N.Vəzirov.

**NAQAFİLLİK** *is.* Gözlənilməzlik, nagahanlıq; gözlənilməz olma. *Gəlişin naqafilliyi. Ölümün naqafilliyi.*

**NAQAN** [*xüs. is.*-dən] Hərlənən topu (barabanı) olan tapança növü. [Balaqardaş:] *Güldəstə! Bir gözümün içinə dürüst bax! Bu naqanı görürsənmi?* N.Vəzirov. *Dəmirov .. naqanı götürüb, topunu hərlədi, sonra qobura qoydu..* S.Rəhimov.

**NAQİL** *is.* [*ər.*] 1. *xüs.* bax **keçirici**. *Metal elektrik naqilidir.*

2. *köhn.* Daşıyan, bir yerdən başqa bir yerə aparan, nəql edən. *Mən ki böyük çayam, xalqa naqiləm; Səbəb odur bu qanuna tabeyəm.* A.Səhhət.

3. *köhn.* Nəql edən, rəvayət edən; eşitdiyi, bildiyi əhvalatı başqasına danışan, çatdıran; ravi.

**NAQİLLİK** *is. fiz.* Nəql etmə, keçirtmə, ötürmə qabiliyyəti; keçiricilik. *Metalların naqillik qabiliyyəti.*

**NAQİS** *sif.* [*ər.*] 1. Tam və mükəmməl olmayan, yarımçıq, natamam, əskik. *Naqis kitab. Naqis məktub. – Çağırdı yarımı əğyar, qaldı ülfəti naqis.* S.Ə.Şirvani.

2. Eyib və qüsuru olan; nöqsanlı, eyibli, qüsurlu. *Cahangir ağa zəif iradəli, naqis ağıllı, düşkün fikirli bir adam idi.* Ə.Vəliyev. □ **Naqis etmək** – nöqsanlı etmək, şikəst etmək. [Həsən ağa:] *Hüsnü xanım mənə yalvararaq: – Nə üçün məni naqis edirsən? – dedi.* M.S.Ordubadi.

3. *riyaz. köhn.* Çıxma əməli. *Beş naqis iki – elər üç.*

**NAQİSLİK** *is.* 1. Qüsurluluq, natamamlıq; qüsurlu, nöqsanlı olma. [Şagirdin] *zəifliyi öz təbiətindən yox, bizim tərbiyə üsulumuzun naqisliyindən irəli gəlirmiş.* M.Hüseyn.

2. Naqis olma, eyiblilik, eyib və qüsuru olma. *Bir qadın kimi* [Səidənin] *zahiri görkəmində böyük naqisliklər vardı.* B.Bayramov.

**NAQİSÜLƏQL** *sif.* [*ər.*] *köhn.* Ağıldan naqis, ağıldan zəif, kəm.

**NAQQA, NAQQABALIĞI** *is. zool.* Şirin suda yaşayan üstü pulsuz, bığlı, iri yırtıcı balıq. *Dəryalar tutdu məni; Naqqalar uddu məni.* (Bayatı). *Naqqabalığın çəkisi iki puda yaxın, uzunluğu təqribən iki metr idi.*

**NAQQAL** *sif.* Çox, boş-boş danışmağı sevən; lağlağı, boşboğaz, gəvəzə, çərənçi. *Naqqal adam. – Bu şəhərin arvadları çox dilli-ağızlı, özləri də çox naqqaldırlar.* "Mol. Nəsr.". // İs. mənasında. *Nəfs deyir: baxma naqqal sözünə; Xeyrin gələn yerə ar eyləməynən.* Aşıq Ələsgər. *İndi də daş kimi dilsiz oturan adam danışdı: – Bu naqqal haradan gəlib çıxdı, baş-qulağımızı apardı.* M.İbrahimov.

**NAQQALLAMA** "Naqqallamaq"dan *f.is.*

**NAQQALLAMAQ** *f.* Naqqallıq etmək, boş-boş danışmaq, çərənləmək.

**NAQQALLAŞMA** "Naqqallaşmaq"dan *f.is.*

**NAQQALLAŞMAQ** *f.* 1. Naqqal olmaq, naqqallığa alışmaq, adət etmək.

2. Naqqallıq etmək, boşboğazlıq etmək. *Siz buyuruğunuzu buyurun, bəy,* – [deyə] *Alagöz naqqallaşmağa başlayan Müqim bəyin sözünü kəsdi.* S.Rəhimov.

**NAQQALLIQ** *is.* Boş-boş danışma; boşboğazlıq, çərənçilik. [Nəcəf:] *Sən naqqallıqdan nə vaxt əl çəkəcəksən? Bu iş sənə baha oturar.* Q.İlkin □ **Naqqallıq etmək (eləmək)** – boş-boş danışmaq, çox danışmaq, boşboğazlıq etmək, çərənləmək. [Qıdı Kirvə:] *..Bağışlayasız, çox naqqallıq elədim, gedim görüm, qatırlarım necə oldu.* N.Vəzirov. [Allahverdi İmamverdiyə:] *Naqqallıq eləmə, yeri görüm!* C.Cabbarlı. [Səfər bəy*:*] *Bu gün Mirzə Turabın başı bir dəfə dolmuşdur, naqqallıq eləyir.* B.Talıblı.

**NAQQAŞ** *is.* [*ər.* nəqqaş] 1. Evlərin divarlarına, tavanına, şeylərin üstünə yağlı və ya sulu boya ilə naxış vuran sənətkar.

2. Rəssam, şəkilçəkən. *Məcmuəmizin naqqaşı səni görən kimi gözəl surətini məcmuəmizə salıb sənin .. məşhur olmağına cidd-cəhd edərdi.* C.Məmmədquluzadə.

**NAQQAŞKAR** *is.* [*ər.* nəqqaş və *fars.* ...kar] Naxış ustası, naxış vuran sənətkar.

**NAQQAŞKARLIQ** bax **naqqaşlıq**. *Naqqaşkarlıq etmək.*

**NAQQAŞLIQ** *is.* 1. Naqqaşın işi, peşəsi; rəssamlıq.

2. Naxış vurma işi. [İsmayılzadə:] *Yaxşı, yoldaş mühəndis, bəs sarayın naqqaşlıq işi necə olacaq?* Z.Xəlil.

**NAQOLAY** *sif.* və *zərf* Qolay olmayan; rahat olmayan. *Naqolay stul. Naqolay oturmaq. Yerim çox naqolaydır.*

**NAQUS** *is.* [*ər.*] *klas.* Kilsə zəngi. *Taki səsləndi qəflətən naqus; Oldum ol vaxt büsbütün məyus*. A.Səhhət.

**NAL**[1] *is.* [*ər.* nəl] 1. Sürüşməkdən və zədələnməkdən qorumaq üçün at, qatır və s. heyvanların dırnaqlarına vurulan müvafiq formada hazırlanmış dəmir lövhəcik.

2. Ayaqqabıların dabanına, bəzən pəncəsinin qabaq hissəsinə vurulan nazik dəmir lövhəcik. *Çəkmə dabanına nal vurdurmaq.* – *Həkim başmağının nalını daşa vurub taqqıldada-taqqıldada .. getdi.* Çəmənzəminli. *Alışın başmaqlarının nalı köhnə taxtaları tərpədir, yuxuya getməyimizə mane olurdu.* Ə.Vəliyev.

◊ **Gah nala vurur (döyür), gah mıxa** – fikrinin, sözünün üstündə durmur, tərəddüd edir.

**NAL**[2] *is. xüs.* Tirin altına qoyulan ağac. *Yeddi-səkkiz qadın Məşədinin yıxıq daxmasına hücum edir, qızlar daxmanın nallarına ip bağlayıb dartır, qara palçıqdan hörülmüş daşlar tökülür*(*dü*).. Çəmənzəminli.

**NALAN** *sif.* və *zərf* [*fars.*] Ağlayan, ah-zar edən, inləyən, nalə edən, fəğan edən, göz yaşı tökən. *Çox eşqə həvəs edəni gördüm ki, həvasın; Tərk etdi sənin aşiqi-nalanını görgəc*. Füzuli. *..Bu yerdə Əmir və hamı daxil olub Leylanı nalan gördülər.* Ü.Hacıbəyov.

**NALAYİQ** *sif.* [*fars.* na... və *ər.* layiq] Layiq olmayan, yaraşmayan, layiqsiz. *Nalayiq hərəkət. Nalayiq söz.* – [Müəllim:] *Uşaqlarınıza nəsihət edin, belə nalayiq hərəkətlərdən əl götürsünlər*. Ə.Haqverdiyev. *..Amma bununla belə, yenə də əvvəlki kimi* [Tükəzbanın] *dalınca nalayiq sözlər söylənilirdi.* B.Talıblı.

**NALAYİQLİK** *is.* Layiq olmama, yaraşmazlıq, layiqsizlik; nalayiq hərəkət, söz.

**NALBƏND** *is.* [*ər.* nəl və *fars.* ...bənd] Heyvanların ayağına nal vuran; nalçı. *Axsaq atın kor nalbəndi olar*. (Məsəl). *Koroğlu baxdı ki, nalbənd çox xoşsifət bir kişidir.* "Koroğlu". *Bakıda ümumiyyətlə peşəkarlar: nalbənd, qundaqsaz, bıçaqçı, başmaqçı və sairə çox olardı*. H.Sarabski.

◊ **Dəvə nalbəndə baxan kimi baxmaq** – çox təəccüblə, heyrətlə, gözlərini bərəldərək baxmaq. *Dəvə nalbəndə baxan kimi nə gözünü zilləyib baxırsan?* "M.N.lətif."

**NALƏ** *is.* [*fars.*] Ah-zar, inilti, sızıltı, fəryad, fəğan. *Seyyid, aşiq olanı bilmişəm aşiqlər işin; Ah imiş, nalə imiş, giryə imiş, şivən imiş.* S.Ə.Şirvani. *Məsum uşaqların naləsi, məzlum anaların fəryadı göylərə səda salmışdı*. S.S.Axundov. □ **Nalə etmək (çəkmək, qoparmaq)** – fəryad etmək, inləmək, ağlamaq. [Dərviş:] *Qızım, neçə gün və neçə gecədir sən burada nalə edirsən?..* Ə.Haqverdiyev. *Fəqət yenə ana qəlbi ayrılmamış övladından; Gecə-gündüz çörək deyib nalə çəkmiş hər laylası.* S.Vurğun.

◊ **Naləsi ərşə çıxmaq** – ucadan ağlamaq, ah-zar etmək, fəryad etmək. [İmran:] *O gün, yadındadırmı, göz ağrısından nalən ərşə çıxmışdı.* S.S.Axundov.

**NALQIRAN** *sif.* Çınqıllıq, xırda daşlıq; naltökən. *Bunlarsız aşmaq olmaz qısıq, dar gədikləri; Nalqıran yoxuşları, sıldırımlı dikləri.* M.Müşfiq.

**NALLAMA** "Nallamaq"dan *f.is.*

**NALLAMAQ** *f.* Nal vurmaq. *Atı nallamaq.*

**NALLANMA** "Nallanmaq"dan *f.is.*

**NALLANMAQ** *məch.* Nal vurulmaq. *Dağlarda qar səsi var; Yox deyil, var səsi var; Kəhər atlar nallanır; Yenə səfər səsi var*. (Bayatı).

**NALLANMIŞ** *f.sif.* Nal vurulmuş; nallı. *Nallanmış at.*

**NALLATMA** "Nallatmaq"dan *f.is.*

**NALLATMAQ** *icb.* Nal vurdurmaq. [Koroğlu:] *Yay olanda dağa yollat; Yaz olanda ipçin nallat!* "Koroğlu". [Niyaz] *sabahı günü nalbənd çağırdı. Boz atı ipçin nallatdı.* Ə.Vəliyev.

**NALLI** *sif.* Nal vurulmuş; nallanmış. *Nallı at.* – *Əyilmiş çəkmənin nallı dabanı; Siyrilib papağın o yan-bu yanı*. H.K.Sanılı.

**NALŞƏKİLLİ** *sif.* Nala oxşayan, nal kimi olan; yarımdairəvi.

**NALTÖKƏN** b a x **nalqıran**. *Naltökən yamac.* – *Naltökən dağları yel kimi keçər; Hər zümrüd yamacdan bir çiçək seçər.* S.Vurğun.

**NAM** *is.* [*fars.*] 1. Ad. *Koroğlu namın götürən; Yurdunda son olan yoxdu*. "Koroğlu". *Qəm yemə, təxfif ver amalına; Az çəkər, heykəl yaparlar namına.* A.Səhhət. [Nümayəndə:] *Torpaq komissarlığı namindən xəlayiqin səhhətinə bais olası bu suyun lentini kəsirəm*. Ə.Haqverdiyev. ☐ **Nam almaq (çıxarmaq)** – şöhrət qazanmaq, məşhur olmaq, adı çıxmaq. *Qəflətdə yatıb, ad batırıb nam alırız biz; Başa yumruq zolladırız, kam alırsız biz.* M.Ə.Sabir.

2. **Naminə** şəklində *tənt*. – xatirinə, xatiri üçün, şərəfinə, uğrunda, ...üçün. *İnsan səadəti naminə quruculuq, yaradıcılıq uğrunda mübarizə. – Bütün xalq .. böyük məqsəd naminə çalışır.* M.İbrahimov. *Dağ əzəmətli tanklar düşmənə hücum edir; Qopur "ura" səsləri azad vətən naminə.* Ə.Cəmil.

**NAMAZ** *is.* [*fars.*] *din*. Müsəlmanların gündə beş dəfə müəyyən vaxtlarda müəyyən qaydalar üzrə icra etməli olduqları ibadət. ☐ **Namaz qılmaq** – bu ibadəti icra etmək. [Məşədi Əhməd] *adəti üzrə ucadan sübh namazını qılırdı.* S.Hüseyn. [Kişi] *bir bucaqda salınmış qələmkar canamaz üstə qiraətlə namaz qılır.* H.Sarabski.

**NAMAZGAH** *is.* [*fars.*] *köhn. din*. Namaz qılmaq üçün yer. [Birinci məmur] *arqadaşına imamzadə ilə namazgahı göstərir*. H.Cavid. *Şah məscidinin çox böyük səhnindən başqa, bir neçə namazgahı da vardı*. P.Makulu.

**NAMAZLIQ** *sif. dan.* Üzərində namaz qılmaq üçün xalça, örtü və s. *Namazlıq xalça.*

**NAMDAR** *sif.* [*fars.*] *klas.* Ad qazanmış, adlı-sanlı, məşhur, şöhrətli, tanınmış. [Qərib:] *Haq səni dünyada namdar eyləsin; Ağlaram, sızlaram, kimsəm yox mənim.* "Aşıq Qərib". *İkinci otaqda .. səfəviyyə nəslindən vəfat edən padşahların və namdar şahzadələrin təsviri çəkilmişdi.* M.F.Axundzadə.

**NAMEHRİBAN** *sif.* və *zərf* [*fars.* na... və *ər.* mehriban] Mehriban olmayan, soyuq olan; sərt, şəfqətsiz. *Əzəl gün mehr edərdin ta könül oldu giriftarın; Dönüb, ey səngdil, daşə, əcəb namehriban oldun.* S.Ə.Şirvani. *Rüstəm kişinin sözləri qiyabi olaraq Mayanın ürəyində Qoşatxana qarşı namehriban bir duyğu oyatmışdı.* M.İbrahimov.

**NAMEHRİBANLIQ** *is.* Qeyri-mehribanlıq, şəfqətsizlik, münasibətdə soyuqluq, sərtlik.

**NAMEYİ-ƏMAL** *is.* [*fars.* namə və *ər.* əmal] Dini etiqada görə, hər bir şəxsin bu dünyada gördüyü bütün savab və günahları yazılmış kitabça. [Məşədi:] *Ay qurbanın olum, nameyi-əmalımı mənə daldan göstərirsən, mənim ki başımın dalında gözüm yoxdur.* Ə.Haqverdiyev. // *məc. zar.* Bir şəxsin bütün əməlləri qeyd olunmuş kağız, sənəd. *Onun nameyi-əmalını əlinə verdilər. – Çünki anketlər Anketov üçün nameyi-əmal hökmündə idi*. Mir Cəlal.

**NAMƏ** *is.* [*fars.*] Məktub, kağız. *Bir namə yazım, badi-səba yarə yetirsin.* Heyran xanım. *Vaqifin Vidadiyə və Vidadinin Vaqifə yazdıqları namələri möhtərəm oxucular mütaliə buyursalar sözümüzü təsdiq edərlər*. F.Köçərli. [Vaqif:] *Oxu bu naməni, əzizim Eldar; Qoy mənim dərdimi dinləsin dağlar*. S.Vurğun.

...**namə** [*fars.*] İsimlərə qoşularaq, onlardan göstərdiyi şeyə dair kitab, risalə, vərəqə, sənəd və s. mənası bildirən sözlər düzəldilir; məs.: "Şahnamə", "Dərbəndnamə", salnamə, əhdnamə, şəhadətnamə, etibarnamə, müraciətnamə və s.

**NAMƏHRƏM** [*fars.* na... və *ər.* məhrəm] 1. *is.* İslam dininə görə, qadının yaşınmalı olduğu kişi, yaxud kişinin görməyə ixtiyarı olmadığı qadın (qız). *Naməhrəmdən yaşınmaq köhnədən qalma adətdir*. – [Məşədi Qədir:] *Yəni arvadlar gərək üzlərini açsınlar, naməhrəmlər də onlarla söhbət etsinlər.* T.Ş.Simurq.

2. *sif.* Şəriətə görə, məhrəm olmayan. [Sona xala:] *A qoca qarı, heç həya etmirsən ki, üzünü açıb bu naməhrəm kişilərə göstərirsən.* S.S.Axundov. [Yaşlı kişi:] *Mən yad və naməhrəm qadınları qonaq saxlamağa hazır deyiləm, – dedi.* S.Hüseyn.

3. *sif.* Yad, özgə, kənar. *Xotkar özü tapşırıb ki, gərək bir naməhrəm adam Nigar xanımın boyunu görməsin*. "Koroğlu".

**NAMƏQBUL** *sif.* [*fars.* na... və *ər.* məqbul] Məqbul olmayan, qəbul oluna bilməyən, işə keçməyən. *Naməqbul iş*. // Münasib olmayan, namünasib. *Mühərrir özgə bir əlac tapmayıb, məzkur həcvin bəzi naməqbul yerlərini atıb.* F.Köçərli.

**NAMƏLUM** *sif.* [*fars.* na ... və *ər.* məlum] Məlum olmayan, tanınmayan, bilinməyən; məchul. *Naməlum yer. – Naməlum adam çayı keçmək üçün körpüyə yanaşmadı.* M.S.Ordubadi. [Qoca usta] *əsəbi bir halda işləyir, arabir şübhəli nəzərlə naməlum adama baxırdı.* A.Şaiq. ◻ **Naməlum qalmaq** – məlum olmamaq, bilinməmək, aydınlaşmamaq, məchul qalmaq, örtülü qalmaq. [Qarı:] *Bir gün dedilər, Güləndam öldü; Nə dərddən öldü, orası naməlum qaldı*. Çəmənzəminli.

**NAMƏLUMLUQ** *is.* 1. Məlum olmama, tanınmama, bilinməmə; məchulluq.

2. Qeyri-müəyyənlik. *..Qarşıdakı naməlumluq .. Tapdığı qorxutmuşdu.* Ə.Əbülhəsən.

**NAMƏRBUT** *sif.* [*fars.* na... və *ər.* mərbut] Nalayiq, namünasib. *Namərbut söz. –* [Fəxrəddin bəy:] *Bilirsən nə var, ana, belə namərbut hərəkət ancaq bizim bu xaraba vilayətdə baş verə bilər..* N.Vəzirov. *Camaat arasında namərbut, namünasib hərəkətlər artıb.* Mir Cəlal. // Söyüş məqamında işlənir (bəzən zarafatla). [Hacı Mehdi:] *Bəs, namərbut, neçə vaxtdır gəlib, mənə niyə xəbər eləməyibsən?* Ə.Haqverdiyev. [Hacı Murad:] *Kəs səsini nadürüst, namərbut!* S.S.Axundov.

**NAMƏRD** *sif.* [*fars.*] Alçaq, müxənnəs, nakişi, əclaf. *Namərd adam.* // Vəfasız. [Serqo:] *Gözəl eşqində könül yanar, sızlar; İnsaf, mərhəmət yox namərd fələkdə.* H.Cavid. ◻ **Namərd çıxmaq** – əhdi pozmaq, vəfasızlıq etmək, xain çıxmaq, xəyanət eləmək. *Gülnar xanım bir vaxt ayıldı, baxıb gördü, ay dad-bidad, heç kəs yoxdu. Elə o saat bildi ki, qız namərd çıxıb.* (Nağıl). // İs. mənasında. [Koroğlu:] *Xəbər alın o namərdin zatını; Aparıbdı mərd igidin atını*. "Koroğlu". *Namərd körpüsündən rahət keçincə; Razıyam apara o sellər məni*. Q.Zakir. [Pəri xanım:] *Mən gərək ürəyimi sındıran, mənə zülm edən namərddən qisas alam*. Ə.Haqverdiyev.

**NAMƏRDLİK** *is.* Alçaqlıq, nakişilik; xainlik, xəyanət, vəfasızlıq, əhdi pozma. [Süleyman:] [Qızı] *elə gəlmişkən özüm üçün istəyim! Yox, bu, yoldaş haqqında namərdlik olar*. Ü.Hacıbəyov. *Cavan bir adamın arzusunu könlündə qoymaq namərdlik olar.* Ə.Vəliyev.

**NAMXUDA** [*fars.* name-xuda] "Maşallah", "gözə gəlməsin", "göz dəyməsin" mənalarında işlədilən tərif sözü. [Heydərəli:] *Maşallah, namxuda, heç builki kimi sən baş çapmamışdın.* M.Əliyev. [Nənəqız:] *..Kişi elə yaxşılaşıb ki, namxuda, deyirsən, bəs heç üstündən qış addamayıb*. Ə.Vəliyev.

**NAMİZƏD** *is.* [*fars.*] 1. Bir vəzifəyə, yerə seçilmək, irəli çəkilmək, təyin və ya qəbul olunmaq üçün adı göstərilən şəxs. *Deputatlığa namizəd.* – [2-ci qadın:] *Biz səni kənd Şurası sədrliyinə namizəd seçmişik.* Ə.Haqverdiyev. *Məcnun roluna ən yaxşı namizəd Hüseynqulu idi*. S.Rəhman.

2. İlk, kiçik elmi dərəcəsi olan şəxs. *Filoloji elmlər namizədi. Tibb elmləri namizədi.*

3. *köhn.* Nişanlı, adaxlı, ad olmuş. [Nisə xanım:] *O, xana bildirəcəkdir sən guya onun namizədinə göz dikirsən..* M.F.Axundzadə. [Hambal:] *Məşədi, deyəsən, qızın iki namizədi vardır*. Ü.Hacıbəyov.

**NAMİZƏDLİK** *is.* 1. Namizəd (1-ci mənada) kimi çıxışetmə imkanı və ya hüququ. *Namizədliyini irəli sürmək.*

2. İlk, kiçik elmi dərəcə ilə əlaqədar olan. *Namizədlik dərəcəsi. Namizədlik imtahanı. – Mövzu götürüb namizədlik dissertasiyası yazmaq istəyirdim.* M.Hüseyn. ◻ **Namizədlik minimumu** – seçilən sahədə elmi tədqiqat işi aparmaq, müvafiq elm sahəsində elmlər namizədi dərəcəsi almaq və dissertasiyanı hazırlamaq üçün lazım olan biliklərin məcmusu. *Namizədlik minimumu vermək.*

**NAMLU** *is.* Lülə (topda, tüfəngdə və s.). *..Topun namlusundan mərmi çıxdıqca yer dartınıb gücə düşmüş kimi silkələndi, sarsıldı.* Ə.Əbülhəsən. *Tüfəng namlusuna söykənərək mən; Bu soyuq səngərdə təkcə durmuşam.* Ə.Cəmil.

**NAM-NİŞAN** *is.* [*fars.*] Ad, yer-yurd, əsilnəsəb mənasında. *Nam-nişanını bilmək* (*öyrənmək*). – [Hakim] *arvadın nam-nişanını bilib, çıxıb gedir*. "M.N.lətif."

**NAMÖHKƏM** *sif.* [*fars.* na... və *ər.* möhkəm] Möhkəm olmayan, davamsız. *Bu da göstərir ki, mövqeyim olduqca namöhkəmdir.* M.S.Ordubadi.

**NAMURAD** *sif.* və *is.* [*fars.* na... və *ər.* murad] Muradına çatmamış; uğursuz, bəxtsiz, talesiz. *Rəhm et məni-zarü namurada; Qoyma bu məşəqqətü bəlada.* Füzuli. *Saqi,*

*məni-namuradə; Dərdi-sər verme ziyadə*. Q.Zakir. *Dar günümdə qohum-qardaş yad olu; Məğrurluq eyləyən namurad* (z.) *olu*. Aşıq Ələsgər.

**NAMUS** *is*. [*ər.*] 1. İnsanın öz şəxsi və ictimai davranışını təyin edən mənəvi və əxlaqi prinsiplərin məcmusu; şərəf, qeyrət, heysiyyət. [İmamverdi:] *Bəy, namus bir bəyzadələrdə deyil, kasıb-küsubun da özünə görə namusu var və namusum da məni qeyzlənməyə vadar eləyir*. Ə.Haqverdiyev. [Nazlı:] *Maral! Maral!.. Həyat beşgünlükdür, fəqət namus... Namus əbədidir*. H.Cavid. [Babası Fatmaya:] *Sənin namusun olsa, mənim qapıma gəlməzsən, itil gözümün qabağından, çəngi!* Çəmənzəminli. ☐ **Namusdan salmaq** – ləkələmək, abırdan salmaq, biabır etmək, rüsvay etmək. **Namusuna qısılmaq** – abır gözləmək, öz heysiyyətini, şərəfini gözləmək. **Namusuna toxunmaq** – bax **qeyrətinə toxunmaq** (“**qeyrət**”də). [Mərcan bəy:] *Buraxın, məni tutmayın, bu saat mən bu kişini qanına bələşdirim, bu mənim namusuma toxunan işdir*. Ü.Hacıbəyov. **Namusunu satmaq** – özünü rüsvay etmək, abırdan salmaq, öz heysiyyət və şərəfini atmaq. [Səttar xan:] *Namərd sən özünsən, sən həm bacının, həm də vətənin namusunu satmaq istəyirsən*. M.S.Ordubadi. [Gülnaz] *qaravaş kimi işləyir, amma namusunu satmağa razı olmur*. M.İbrahimov. // Bəkarət, ismət, təmizlik.

2. **Namusla** şəklində *zərf* – 1) şərəflə, şərəf və heysiyyətini gözləyərək. *Namusla yaşamaq. – Mən deyirəm; Bu namusla yaşayanlar bəxtiyardır*. S.Vurğun. *Namusla sürmüşəm öz dövranımı; Verərəm haqq üçün şirin canımı*. M.Rahim; 2) çox yaxşı, yüksək səviyyədə, əla surətdə. *Namusla işləmək. Öz vəzifəsini namusla və vaxtında yerinə yetirmək*.

**NAMUSLU** *sif.* Abırlı, ismətli, əxlaqlı, qeyrətli, mənəviyyatca təmiz. [Anaxanım] *namuslu və çalışqan bir qadın idi*. A.Şaiq. [Dürrə] *bilirdi ki, adaxlısı təmiz və namuslu adamdır*. S.Vəliyev. // Təmiz, vicdanlı, düz. *Namuslu adam. – Məşədi sadəürəkli, səmimi və son dərəcə namuslu bir oğlan idi*. M.Hüseyn.

**NAMUSSUZ** *sif.* Namusdan məhrum, namusu olmayan, qeyrətsiz. *Namussuz kişi*. – [Sara:] *Siz məni namussuz qızlaramı bənzədirsiniz!* C.Cabbarlı.

**NAMUSSUZLUQ** *is*. Qeyrətsizlik, şərəfsizlik, namusdan məhrumluq. [Huri xanım:] *Mən bu namussuzluğu götürə bilmərəm*. “Koroğlu”.

**NAMÜƏYYƏN** *sif.* [*fars.* na... və *ər*. müəyyən] Müəyyən olmayan, qeyri-müəyyən. *Namüəyyən məlumat. – Cavablar da namüəyyən, qısa, kiçik olur, heç kəsi təmin etmirdi*. Mir Cəlal.

**NAMÜƏYYƏNLİK** *is.* Qeyri-müəyyənlik, müəyyən olmama.

**NAMÜMKÜN** *sif.* [*fars.* na... və *ər*. mümkün] Mümkün olmayan, qeyri-mümkün. [Vasif:] *Onu qandırmış o xain, lakin; Mən sağ olduqca bu iş namümkün*. H.Cavid.

**NAMÜNASİB** *sif.* [*fars.* na... və *ər*. münasib] 1. Münasib olmayan, qeyri-münasib, yersiz. *..İlin belə bir namünasib fəslinə baxmayaraq, təbiblərin əmrinə görə azarlını Tiflisə göndərməyə məcbur olduq*. C.Məmmədquluzadə. *Şərəfoğlunun belə namünasib vaxtda gəlməsi Rüstəm kişini çaşdırmışdı*. M.İbrahimov. // Ləyaqətsiz, layiq olmayan; pis, yaraşmayan. *Namünasib yerə gedib-gəlməyə; Namusu, qeyrəti, arı gərəkdir*. Q.Zakir.

2. Ədəbsiz, yaramaz, nalayiq. *Namünasib hərəkət. Namünasib söz*. – [Vəzir:] *Əyərçi namünasib təklifdir, amma müzayiqə yoxdur*. M.F.Axundzadə. [Axund:] *Özünüz, şükür, durbin adamsınız. Beşinci ildən, iğtişaşlardan sonra camaat arasında namərbut, namünasib hərəkətlər artıb*. Mir Cəlal.

**NAMÜNASİBLİK** *is.* Münasib olmama, qeyri-münasiblik, yersizlik.

**NAMÜRÜVVƏT** *sif.* [*fars.* na... və *ər*. mürüvvət] Mürüvvəti olmayan, mürüvvətsiz, mərhəmətsiz. [Qədir:] *Bu namürüvvət uşağını tanımırsanmı?* Mir Cəlal.

**NAMÜTƏNAHİ** *sif.* [*fars.* na... və *ər*. mütənahi] İntəhasız, nəhayətsiz, sonsuz, bitməyən, ucu-bucağı olmayan. [Əbülhəsən bəy:] *Mənim varlığım, təbiri-cayizsə, təbiət fəlsəfələri kimi anlaşılmaz və axırı bilinməz namütənahi* (z.) *bir şəkil almışdır*. M.S.Ordubadi. *Öpərkən gecələr dəsti-səbahi; Duyurdum hərəkət namütənahi*. S.Vurğun.

**NAMVAR** *sif.* [*fars.*] *köhn.* 1. İgid, qəhrəman, pəhləvan.

2. Adlı, sanlı.

**NAN** *is.* [*fars.*] *klas.* Çörək. *Kəl qoşub kotan əkməyən; Nanın süfrəyə tökməyən; Arının qəhrin çəkməyən; Balın qədrini nə bilir?* "Koroğlu". *Ey dərbədər gəzib ürəyi qan olan çocuq! Bir loğma nan üçün gözü giryan olan çocuq*. M.Ə.Sabir. *Olmur, qoy olmasın quru bir nanın, ay yazıq; İşlə çıxınca cisimdəki canın, ay yazıq!* Ə.Nəzmi.

**NANAY** *is.* Uzaq Şərqdə yaşayan xalq; həmin xalqa mənsub olan adam.

**NANDİ** *is.* Afrikada yaşayan qohum xalqlar qrupu.

**NÁNDU** *is.* Uça bilməyən quşlar qrupu; Amerika dəvəquşuları.

**NANƏ** [*ər.*] *bot.* Yeyilən çoxillik ətirli göyərti növü. *Nanə qurutmaq. Üç dəstə nanə.* ☐ **Nanə cövhəri (arağı)** – nanədən çəkilən araq, cövhər (təbabətdə işlədilir).

◊ **Ürəyi nanə yarpağı kimi (tək) əsmək (titrəmək)** – b a x **ürək**. **Üstündə nanə yarpağı tək (kimi) əsmək** – son dərəcə əzizləmək, qeydinə qalmaq, nazını çəkmək. *Uşağın üstündə nanə yarpağı tək əsmək.*

**NANƏCİB** *sif.* və *is.* [*fars.* na... və *ər.* nəcib] Haqq-say itirən; nankor, şərəfsiz, yaramaz, namərd, bədəsil. *Nanəcib adam.* – [Hafizə xanım:] *Gəl bundan sonra nanəcibə yaxşılıq elə*. Ə.Haqverdiyev. [Nəbi:] *Amma bizim bu nanəcib bəylərimiz davam edirlər*. S.S.Axundov. ☐ **Nanəcib çıxmaq** – yaxşılığını itirmək, haqq-say itirmək, zəhməti batırmaq. [Mələyin anası:] *Gədə çox nanəcib çıxıb.* M.İbrahimov.

**NANƏCİBLİK** *is.* Namərdlik, şərəfsizlik, nankorluq, haqq-say itirmə. *Kasıblıq eyib deyil, nanəciblik eyibdir*. Mir Cəlal.

**NANIX** *sif. məh*. Bacarıqsız, fərsiz.

**NANKOR** *sif.* və *is.* [*fars.*] Yaxşılıq bilməyən, haqq-say itirən, yaxşılığı yerə vuran, duz-çörək itirən. [Şeyx Hadi:] *Mərvan! Görmədim mən sənin qədər nankor; Bir gözün kor deyil ki, vicdan kor!* H.Cavid. [Gileygüzarov:] *Mən bu hekayəni övladlarını başlıbaşına buraxmış nankor atalar əleyhinə yazmışam*. S.Rüstəm.

**NANKORLUQ** *is.* Yaxşılıq bilməmə, haqq-say itirmə, yaxşılığı yerə vurma. [Hümmətəli:] .. *nankorluğun bu cür ağır bir fəlakətə gətirib çıxaracağını əvvəldən düşünmədiyinə görə peşmançılıq çəkirdi.* M.Hüseyn.

**NAPAK** *sif.* və *is.* [*fars.*] 1. Pak olmayan, təmiz olmayan, murdar. *Napakı hamam təmizləməz*. (Ata. sözü). *Arvadın bu sözləri, deyəsən, usta Ağabalanın ağlına batdı, bir az saqqalını tumarlayıb dedi*: *– Onda gərək gedim qabaqca hamama, yoxsa napak* (z.) *qəbz almaq olmaz*. Çəmənzəminli.

2. Mənən, əxlaqca təmiz olmayan; ləkəli.

**NAR**[1] *is.* [*fars.*] İçərisində şəffaf pərdə ilə örtülmüş çoxlu turş, meyxoş və ya şirin dənələri olan sərt qabıqlı girdə meyvə. *Gülöyşə nar. Şirin nar. Qırmızı nar. – Nar kollarının arasında üç əsgər söhbət edirdi*. Ə.Əbülhəsən. // Bu meyvənin al-qırmızı rəngli gül açan tikanlı ağacı. ☐ **Nar kimi** – qırmızı, qıpqırmızı. *Nar kimi qızarmaq. Nar kimi yanaq.* – [Atası] *oğlunun pəncərəsinin yanından ötərkən nə gördü: oğlunun sifəti nartək qızarmış, gözləri böyümüş*(*dü*). Ə.Haqverdiyev.

**NAR**[2] *is.* [*ər.*] *klas.* Od, atəş. [Qərib:] *Bir söz ilə eldən-elə atıldım; Bu qərib ellərdə yaxdı nar məni.* "Aşıq Qərib".

**NARAHAT** *sif.* və *zərf* [*fars.* na... və *ər.* rahət] 1. Rahatlığı, dincliyi pozulmuş; rahatsız, rahatlığını itirmiş, təşviş və təlaş içərisində olan. *Narahat vəziyyət. Narahat adam. – Qəhrəman bütün gecəni narahat yatmışdı.* S.Rəhimov. *Ovçu dostum narahat bir nəzərlə mənim üzümə baxdı*. M.Rzaquluzadə. ☐ **Narahat etmək** – 1) rahatsız etmək, istirahətini, rahatlığını pozmaq, əziyyət vermək, incitmək. *Vurma şanə zülfünə narahət etmə könlümü*. M.Ə.Sabir. [Nadiri] *narahat edən məsələni Məciddən soruşmaq istəyirdisə də, cürət etməyirdi*. B.Talıblı; 2) həyəcana salmaq, təşvişə salmaq, təlaşa salmaq, qorxutmaq. *Hiss edirdim ki, mənim hüzurum və söhbətim* [Ağaverdini] *narahat edir*. S.Hüseyn. *..Solmaz burada olsaydı, Şiraslan özünü narahat edən ürək sözlərini ona açar*(*dı*). S.Rəhimov. **Narahat olmaq** – 1) rahatlığı, dincliyi pozulmaq; 2) həyəcana, təşvişə, təlaşa düşmək, iztirab keçirmək, nigaran olmaq.

*Əminə isə indi ən çox dəvəçilər haqqında narahat olur*. Ə.Əbülhəsən. *Birinci dəfə həkim nəbzini tutan vaxt Əziz bu cür narahat olmamışdı.* Ə.Vəliyev.

2. Rahat olmayan, münasib olmayan, uyğun olmayan, rahatsız edən, naqolay. *Narahat yer. Narahat oturacaq. – O, narahat maşında da, açıq havada da, quru yerdə də yatıb yuxusunu alır*. M.Rzaquluzadə.

**NARAHATCA(SINA)** *zərf* Narahatlıqla, narahat halda, təlaş içərisində, həyəcanla. *Narahatcasına gözləmək.*

**NARAHATLIQ** *is.* 1. Rahatlıq olmayan hal, rahatlığı pozan şey. *TU yerdən çox sürətlə qopsa da, sərnişinlər heç bir narahatlıq hiss etmir*(*dilər*). M.İbrahimov.

2. Sıxıntı hissi, həyəcan, təlaş, nigarançılıq, təşviş. [Mollayev] *Aslanovla qabaqlaşanda, həmişə nədənsə ürəyində anlaşılmaz bir narahatlıq duyurdu.* M.Hüseyn. *Əfruz bacının narahatlığı Mədədin narahatlığını daha da artırır, onu belə götür-qoy etməyə məcbur edirdi.* S.Rəhimov. ◻ **Narahatlıq keçirmək** – b a x **narahat olmaq** (“**narahat**”da). *Qəhrəman özü də başqa uşaqlar kimi narahatlıq keçirir.* S.Rəhimov.

**NARARMUDU** *is.* Meyvəsi dən-dən olan şirəli payız armudu növü.

**NARAZI** *sif.* [*fars.* na... və *ər.* razı] Razı olmayan, narazılıq ifadə edən; qeyri-məmnun, incik. *Narazı cavab. Narazı ton. – Gözəl qız, sənin bu narazı baxışların mənim buradan getməyimi tövsiyə edir.* M.S.Ordubadi. // İs. mənasında. *Çünki məmləkət daxilində yaşayan narazılar sərhəd xaricində olan düşmənlərin müttəfiqləridir*. M.S.Ordubadi. ◻ **Narazı qalmaq (olmaq)** – razı düşməmək, razı qalmamaq, məmnun olmamaq, incik düşmək. *Salam Həbibin cavabından narazı qaldı.* Mir Cəlal. *Bu gözəl hər kəs idisə, qəzasından narazı olduğu nəğməsindən aşkar görünürdü.* A.Divanbəyoğlu. *Firəngiz köhnə şoferi dəyişib*, [Şahini] *qəbul eləyəndə anası narazı olmuşdu..* B.Bayramov. **Narazı salmaq** – özündən incitmək, küsdürmək, rəncidə etmək. *Yoldaşını özündən narazı saldı*.

**NARAZILIQ** *is.* Qeyri-məmnunluq, razı olmama, inciklik, bir şeyə mənfi münasibət. *Narazılığını bildirmək. Narazılıq göstərmək. – Şükür açıqcasına görürdü ki, ətrafına toplaşan adamlarda ruh düşkünlüyü ilə qarışıq bir narazılıq var.* S.Hüseyn. *Kənd arasında narazılıq başlandı*. İ.Hüseynov. ◻ **Narazılıq eləmək** – razı qalmadığını, razı düşmədiyini bildirmək (göstərmək), narazı olmaq, mənfi münasibətini bildirmək. *..Anam həyatından narazılıq etmir, mənimlə təsəlli tapırdı.* A.Şaiq. *Bəziləri də moizədən narazılıq eləyirdilər*. Mir Cəlal.

**NARBİTİ** *is. zool.* Ağacın yarpaqlarına zərər verən cücü.

**NARDAN, NARDANÇA** *is.* Nardan bişirilən riçal.

**NARƏVA** *sif.* [*fars.*] Rəva görülməyən, xoşa gəlməyən, layiq olmayan, yol verilməyən namünasib; haqsız. *Narəva iş*. – [Şükür] *hökumət kabinəsinin süqutilə bütün narəva hallara bir xatimə çəkiləcəyinə inanırdı*. S.Hüseyn.

**NARGİLƏ¹** *is.* 1. [*fars.*] b a x **sulu qəlyan** (“**qəlyan**”da).

**NARGİLƏ²** *is.* [*fars.*] Azərbaycan oyun havalarından biri. *Nargilə oynamaq*.

**NARIN** *sif.* 1. Son dərəcə xırda, toz kimi. *Narın torpaq. Narın qar. – Yenə saymazyana qırmaclayaraq Abşeronu; Sovurur xəzri narın qumları hiddətlə budur*. S.Rüstəm. *Yaşıl yarpaqlardan asta-asta damcılar damır, narın çiskin təpəl camışın saçaqlı tüklərindən üzüaşağı süzülürdü*. S.Rəhimov.

2. *məc.* Zərif, incə, nazik. *Narın tük. Narın söz. – ..Uzaqdan incə və narın ahənglə çalğı səsi eşidilməyə başlar.* H.Cavid. *Qalxan dumandan çöllər narın sapdan hörülmüş tora bürünmüş kimi görünürdü*. Ə.Əbülhəsən. // Zərf mənasında. *Narın danışmaq. Narın yerimək. – Könül sən ki, düşdün eşqin bəhrinə; Narın çalxan, narın silkin, narın üz.* Aşıq Ələsgər. *Gəlin nə narın süzürdü! Nə dadlı səkirdi!* Çəmənzəminli.

**narın-narın** *zərf* Xırda-xırda, kiçik-kiçik. *Narın-narın addımlamaq. – Adım yazdır, gələndə mən yağış yağar .. narın-narın; Ruhu gülər torpaqların.* S.Vurğun. *Şəhərin işıqları gecənin qaranlıq pərdəsini yırtır və sanki narın-narın tökülən yağışa yol açırdı.* M.İbrahimov.

**NARINC** *is.* [*fars.*] Xoşiyli, acımtıl sitrus meyvəsi və bu meyvənin həmişəyaşıl ağacı.

*Narınca bax, narınca; Saxlaram saralınca; Şama döndü ürəyim; Səndən cavab alınca.* (Bayatı).

**NARINCA** *sif.* Son dərəcə narın, çox xırda; xırdaca. *Uşaqlar narınca qum üstündə oynayırdılar.* – ..[Həbibə] *boylanıb pəncərədən yollara narınca* (z.) *çisələyən yağışa baxdı.* Mir Cəlal.

**NARINCI** *sif.* Narınc rəngli, qırmızıya çalar sarı, portağal rəngində. *Narıncı paltar. Narıncı örpək. – Getdikcə günəş qüruba doğru enir, üfüqün narıncı boyaları qırmızıya çalır.* Çəmənzəminli.

**NARINDİŞ(Lİ)** *sif.* Dişləri sıx və incə; xırdadişli (daraq haqqında).

**NARINLAŞDIRMA** "Narınlaşdırmaq"dan *f.is.*

**NARINLAŞDIRMAQ** *f.* Narın hala salmaq, narın etmək, xırdalamaq, toz halına salmaq. *Duzu narınlaşdırmaq. Torpağı narınlaşdırmaq.*

**NARINLAŞMA** "Narınlaşmaq"dan *f.is.*

**NARINLAŞMAQ** *f.* Narın hala düşmək, narın olmaq.

**NARINLIQ** *sif.* 1. Narın şeyin halı; xırdalıq. *Qumun narınlığı.*

2. *məc.* Zəriflik, incəlik, naziklik. *Tükün narınlığı.*

**NARINTÜK(LÜ)** *sif.* Tükü nazik, zərif, yumşaq olan. *Narıntüklü quş.*

**NARINYARPAQ(LI)** *sif.* Kiçik, xırda, zərif yarpaqları olan. *Narınyarpaq bitki. – Enliyarpaq əvəliyi, narınyarpaq əməköməcini, .. küsəyən bənövşənimi deyim?!* Mir Cəlal.

**NARİNGİ** *is.* Portağala oxşayan ətirli sitrus meyvəsi və bu meyvənin həmişəyaşıl ağacı; mandarin. *Leyla gülümsünüb masanın üstünə çörək, ..alma və naringi mürəbbəsi olan vazlar qoydu.* H.Seyidbəyli.

**NARKOMÁNİYA** *is.* [*yun.*] Narkotik maddələrdən müntəzəm istifadə etmək və ondan daimi asılılıqla səciyyələnən ictimai-psixoloji xəstəlik.

**NARKÓTİK** [*yun.*] Təbabətdə ağrı kəsən və yuxuladıcı dərman kimi işlədilən maddə.

**NARKOTİK** *sif.* [*yun.*] Tərkibində narkoz olan. *Narkotik maddələr.*

**NARKÓZ** *tib.* [*yun.* narkosis – keyləşmə] 1. Hər hansı bir orqanın süni surətdə hissizləşdirilməsi, yaxud operasiya olunan xəstənin süni surətdə yuxuladılıb hissizləşdirilməsi. *Narkozla cərrahiyyə əməliyyatı aparmaq.*

2. B a x **narkótik**.

**NARQOVURMA(SI)** *is. aşp.* İçərisinə nar tökülmüş, narla hazırlanmış qovurma növü.

**NARQURDU** *is. zool.* Narı və bəzi başqa meyvələri zədələyən və onun çürüməsinə səbəb olan həşərat.

**NARLI** *sif.* Nar qatılmış, sində nar olan. *Narlı fətir* (*qutab*).

**NARLIQ** *is.* Nar bağı, nar ağacları əkilmiş yer. [Camal və Zərəfşanın] *Hacı Tarverdi narlığında bir-birinə rast gəlmələri təsadüfi deyildi.* M.S.Ordubadi.

**NARODOVOLÇU** *is. tar.* Rusiyada XIX əsrin 80-ci illərində "Narodnaya volya" adlı gizli siyasi təşkilatın üzvü.

**NARODOVOLÇULUQ** *is. tar.* Rusiyada XIX əsrin 80-ci illərində xalqçıların "Народная воля" adlı təşkilatının rəhbərlik etdiyi ictimai-siyasi hərəkat (bu hərəkat mütləqiyyətlə kütləvi-siyasi mübarizəni siyasi suiqəsd və fərdi terrorla əvəz etməyə çalışırdı).

**NARŞƏRAB** *is.* Nar suyundan hazırlanan şirə. *Balığı narşərabla yemək.* – [Kişi:] *Yaxşı, ürəyim narşərab istəyir, görəsən, orada narşərab verirlər?* A.Şaiq.

**NARYAD** [*rus.*] 1. Hər hansı bir işi görmək, yaxud bir şeyi buraxmaq və ya vermək üçün sənəd, əmr, sərəncam. *Direktorun əmri ilə naryad yazıb, Saleh kişiyə taxta verdilər.* Mir Cəlal. [Şahpəri:] *Sənə iş tapşırıblar, əməkgünlərini yaz, naryadları doldur.* B.Bayramov.

2. Xüsusi tapşırıq üzrə hərbi xidmətçinin gördüyü iş, yerinə yetirdiyi tapşırıq. *Naryadda olmaq. Növbədənkənar naryad vermək.* // Belə tapşırığı yerinə yetirən hərbi xidmətçi dəstəsi. *Sərhəd naryadı.*

**NARZAN** [Şimali Qafqazda coğrafi addan] Kalium-karbonatlı mineral su. *Narzan vannası. Narzan içmək.*

**NAS**[1] *is.* [*ər.* "insan" söz. cəmi] *klas.* İnsanlar, xalq, camaat, el. [Şah:] *İndi mən əfradinasdən bir mərdi-fəqirəm – Abbas Məhəmməd oğlu.* M.F.Axundzadə. *Şeyx Sədi .. nəinki bir şirazlılara və yainki əhli-əcəmə, bəlkə ümum*

*nasa gözəl nəsihətlər və hikmətamiz sözlər deyib*. F.Köçərli.

**NAS²** *is.* Dilin altına qoyulub çəkilən xına rəngli narın tütün növü. *..Türkmən müsafirləri və ya əlvan çapan Buxara tacirləri dizlərin qucuyub nas atırlar*. S.M.Qənizadə. [Hərəmağası] *dilinin altına bir az nas atıb, ulduzları seyr etməyə başladı*. Çəmənzəminli.

**NASAZ** *sif.* və *zərf* [*fars.*] 1. Kefsiz, xəstə kimi, süst, əzgin, xəstəhal. *Nasaz hal. Nasaz olmaq*. – [Cabbar:] *Dünən bir az nasazdım, gəlmədim*. N.Vəzirov. [Bülənd:] *Müəllim, nasaz deyilsiniz ki? ..Kefsizsiniz əgər, istəyirsiniz evə gedin.* Ə.Əbülhəsən. [Əlləzoğlu:] *Bir az nasaz kimiydi, dərdin alım.* İ.Hüseynov.

2. Bir-birilə tutmayan, uyğun olmayan. *Nasaz şey.*

3. Saz olmayan, qaydada olmayan, qüsuru olan, işləyəcək halda olmayan. *Nasaz maşın.*

**NASAZLIQ** *is.* 1. Kefsizlik, süstlük, əzginlik. *Bir azca nasazlığım vardı. Uzanmışdım*. S.Rəhman. *Birdən, necə oldusa, canının nasazlığı .. Qulamın yadından çıxmış kimi oldu.* Ə.Əbülhəsən.

2. Nasaz şeyin halı. *Maşında nasazlıq görünür.*

**NASEH** *is.* [*ər.*] *klas.* Nəsihətçi, öyüdçü; öyüd verən, nəsihət verən. *Məni rüsva görüb eyb etmə, ey naseh ki, məzurəm.* Füzuli. *Nasehlər edir mən məni mütribü neydən*. Q.Zakir.

**NASƏZA** *sif.* [*fars.*] *klas.* Ədəbsiz, namünasib, nalayiq, layiq olmayan, layiq görülməyən. *Nasəza iş. Nasəza hərəkət. – Deməm ki, fasidi vəsf et, saqın fəsadından! Yamanə yaxşı demək nasəza deyil də, nədir?* M.Ə.Sabir. *Mən sinəmi sizin nasəza sözlərinizə sipər eləmişəm.* Ə.Haqverdiyev.

**NASİR¹** *is.* [*ər.*] Nəsr yazan, nəsr əsərləri müəllifi, ədib. *Nasirlərin yeni əsərləri.*

**NASİR²** *sif.* [*ər.*] Kömək edən, köməkçi, yardımçı.

**NASİZM** *is.* [*lat.*] Alman faşist ideologiyası.

**NASÓS** [*rus.*] Su və ya başqa mayeləri, habelə qazı çəkmək və ya vurmaq üçün maşın, mexanizm. *Suyu nasosla vurmaq. Qaz nasosu. Nasosu quraşdırmaq.*

**NASOSÇU** *is.* Nasosa xidmət edən fəhlə.

**NASOSXANA** *is.* [*rus.* насос və *fars.* ...xanə] Nasosların yerləşdiyi bina, yer. [Mədənlərdə] *havabölüşdürən budkaların və nasosxanaların təmirinə dair tapşırıq da yerinə yetirilmişdir.*

**NASOSLAMA** "Nasoslamaq"dan *f.is.*

**NASOSLAMAQ** *f.* Nasosla çəkmək, nasosla vurmaq (suyu, başqa mayeləri və qazı).

**NAŞAD** *sif.* [*fars.*] *klas.* Qəmgin, kədərli, məhzun, sevinməyən. *Yenə naşad könlüm buldu yüz yerdən məlal, ağlar.* M.V.Vidadi. *Bir mənim də nəzər et haləti-naşadıma bəs*. C.Cabbarlı.

**NAŞATIR** *is.* [*ər.*] Ağ kristallik maddə, ammonium-xlorid (texnikada və təbabətdə işlədilir). ◻ **Naşatır spirti** – kəskin iyli, şəffaf, rəngsiz sulu ammiak məhlulu (təbabətdə işlədilir).

**NAŞI** *sif.* [*ər.*] 1. Nabələd, xam, təcrübəsiz, bir işdən yaxşı xəbərdar olmayan. *Naşı usta. Naşı adam. Naşı işçi. – Naşı ovçu bərə bəklər, əylənər; Marallar sayrışır yollara doğru.* Qurbani. *Ailəni iki nəfər naşı və həyata təzəcə atılan, eyni zamanda bir-birini sevən iki adam qurmağa məcburdur*. M.S.Ordubadi. // *məc.* Bişməmiş, püxtələşməmiş, təcrübəsiz, qeyri-kamil. [Yazı] *elə naşı, kobud yazılıb ki, bunu uşaqdan savayı heç kəs yaza bilməz*. C.Məmmədquluzadə. *Şüşənin altında naşı, lakin həyəcanlı bir xətlə .. yazılan bir kağız görürəm..* Mir Cəlal.

2. Nabələd. *Şamo naşı adam dolaşan kimi dolaşır, sonra çox çətinliklə bir nöqtəni tapır və başqa birisinə keçirdi.* S.Rəhimov. // İs. mənasında. *Burada bir naşı ağlar; Əlində kaşı ağlar..* (Bayatı). *Qabağa salma naşını; Vurdurar öz yoldaşını.* "Koroğlu".

**NAŞILIQ** *is.* 1. Xamlıq, təcrübəsizlik. *Cəmil dostunun naşılığını onun özünə hiss etdirmək istəməsə də, Tahir bunu dərhal anlayıb, lap pul kimi qızardı..* M.Hüseyn. [Məşədi Müslüm:] *İndi, yoldaş, neçə il naşılıq eləyəcəksən?* Mir Cəlal.

2. Qabiliyyətsizlik, bacarıqsızlıq, məharətsizlik. [Bəhlul:] *O boyda vəzifə sahiblərindən bəlkə də heç kəs mənim naşılığıma bu qədər dözməzdi*. B.Bayramov.

**NAŞİR** *is.* [*ər.*] Kitab və s. nəşr edən adam. *Qəzetin naşiri Məmmədağa Şaxtaxtlı*

*maarifpərvər, xeyirxah və mütərəqqi bir adam olmuşdur.* M.İbrahimov. □ **Naşiri-əfkar** *köhn.* – hər hansı bir siyasi təşkilata, ittifaqa, idarəyə aid olan və onların fikir və fəaliyyətini əks etdirən mətbuat orqanı.

**NAŞÜKÜR** *sif.* [*fars.* na... və *ər.* şükür] Yaxşılığa qiymət verməyən, yaxşılıq bilməyən; qədirbilməz, nankor. *Naşükür adam.* – [Şəhrəbanu xanım:] *Bu firənglər necə naşükür xalq olurmuşlar. Heç yaxşılıq bilməzmişlər.* M.F.Axundzadə. [Cəmil:] *Axı mənə deyən gərək, sənə nə düşüb ki, naşükür adama yaxşılıq edirsən?* M.Hüseyn. □ **Naşükür olmaq** – edilən hörmətdən, yaxşılıqdan məmnun qalmamaq, heç bir şeydən razı düşməmək, öz taleyindən şikayətçi olmaq, yaxşılıq bilməmək. [Piri baba:] *Yasəmən, səbr et, naşükür olma!* S.S.Axundov. [Qacar:] *Yaxşı, gəl əl götür bu inadından; Bu qədər naşükür olmasın insan.* S.Vurğun.

**NAŞÜKÜRLÜK** *is.* Yaxşılıq, hörmət bilməmə, qədirbilməzlik, nankorluq. *Amma bununla belə Zeynəb bir tikə naşükürlük eləmir.* C.Məmmədquluzadə. [Bəy:] *Yox, naşükürlük bir şey deyil. Mən yaradandan razıyam.* Mir Cəlal.

**NATAMAM** *sif.* [*fars.* na... və *ər.* təmam] 1. Bitməmiş, qurtarmamış, axıra çatdırılmamış, başa vurulmamış, yarımçıq qalmış. *Natamam bina. Natamam əsər.* – [Kamil:] *Amma iş orasındadır ki, xəritə natamamdır, hələ hazır deyil.* M.Süleymanov. □ **Natamam cümlə** *qram.* – əsas üzvlərinin biri və ya ikisi buraxılmış cümlə.

2. Qüsurlu, kəsirli, nöqsanlı. *Natamam iş.* – *Yari-müvafiq olmasa, meydən nə faidə; Mey bəzmi birəfiq ola gər, natəmamdır.* S.Ə.Şirvani.

**NATAMAMLIQ** *is.* 1. Natamam şeyin hal və keyfiyyəti; yarımçıqlıq. *Ümumiyyətlə, pyesdə kompozisiya etibarı ilə bir natamamlıq vardır.*

2. Qüsurluluq, kəsirlilik. *Natamamlığı aradan qaldırmaq.*

**NATARAZ** *sif.* [*fars.*] 1. Kobud(ca), yekə, biçimsiz. *Nataraz adam.* – *Pəri xanım gözlərini açıb gördü ki, evin ortasında nataraz bir pəhləvan oturub.* (Nağıl). [Qurban:] *Çox böyük işə girişirsən, Telli, orada elə nataraz kötüklər var ki.* Ə.Məmmədxanlı. // Ümumiyyətlə, iri, yekə, cüssəli, azman. *Deyirlər ki,* [Koroğlu] *çox nataraz adamdı.* "Koroğlu".

2. *məc.* Kobud, yöndəmsiz, yonulmamış, yontalanmamış. *Natarazın* (is.) *biridir.*

**NATARAZLIQ** *is.* 1. Nataraz şeyin halı.

2. *məc.* Kobudluq, yöndəmsizlik.

**NATƏMİZ** *sif.* və *zərf* [*fars.* na... və *ər.* təmyiz-dən] 1. Təmiz olmayan, çirkli, kirli. *Natəmiz otaq. Natəmiz yer.* – *Kətxudalar Qəzvinin küçələrini natəmiz saxlayırdılar.* M.F.Axundzadə. *Şəhərin natəmiz havasından saralıb heyvaya dönən Nurəddini bir ayın ərzində tanımaq olmurdu.* S.S.Axundov.

2. *məc.* Qəlbiqara, qeyri-səmimi, xain ürəkli. *Ürəkdən natəmiz və bic adamlar nə qədər küt və biliksiz olsa, bəşəriyyət üçün o qədər faydalıdır.* M.İbrahimov.

3. *məc.* Məqsədinə çatmaq üçün heç bir vasitədən çəkinməyən; əliəyri, əli təmiz olmayan. [Nəcəfalı:] *Şahmar deyəndə ki, Hümmət natəmiz adamdır, inanmırdım, şübhə eləyirdim.* B.Bayramov.

**NATƏMİZLİK** *is.* 1. Çirklilik, kirlilik. [Xarrat:] *Biçarə uşaq diqqətsizlik, natəmizlik nəticəsi olaraq öldü.* T.Ş.Simurq. [Həmid müəllim] *cüzi natəmizlik üstündə hamını toplayacaq və acıqlanacaq.* S.Rəhimov.

2. *məc.* Natəmiz adamın xasiyyəti, natəmiz iş, hərəkət.

**NATƏVAN** *sif.* və *zərf* [*fars.*] *klas.* Zəif, taqətsiz, gücsüz, iqtidarsız; xəstə. *Düşmüşəm bir halə sənsiz natəvanü zar olub; Kim, əcəl yanimdən ayrılmaz mənə qəmxar olub.* Kişvəri. *Bu qəm ki var bənim cani-natəvanimdə; Tamam xalq bəna olsa qəmküsar azdır.* Qövsi. *Xoş ol zaman ki, ol məh ilə həmzəban olam; Hər sözdə bir dilim tutulub natəvan olam.* S.Ə.Şirvani.

**NATIQBURUN** *sif.* Burnunun ucu yastı olan. *Natıqburun uşaq.*

**NATİQ** *is.* [*ər.*] 1. Nitq deyən, nitq söyləyən; çıxış edən. *Natiqlər coşaraq söylər azadlıq; Bir çoxu hayqırır: haqq verin bizə!* A.İldırım.

2. Yaxşı danışmaq qabiliyyətinə malik olan, gözəl danışmağı bacaran, natiqlik məharəti olan. *Lütfəli bəy uzunboylu, .. şirindilli və natiq bir adam idi.* İ.Musabəyov. *Uca*

*kürsülərdən danışanda mən; Həm natiq oluram, həm də dinləyən.* B.Vahabzadə.

3. *köhn.* Danışan, söyləyən, deyən. [Münəvvər:] *..İnsan eşitdiyi sözün natiqinə baxıb haman sözü qəbul edər.* M.S.Ordubadi.

**NATİQLİK** *is.* Aydın və gözəl danışma bacarığı, nitq söyləmə qabiliyyəti. [Mehmanın] *natiqlik məharəti isə hamını heyran etməyə başlayırdı.* S.Rəhimov. *..Müdərrislərimiz ondakı natiqliyə qibtə edirlərdi.* İ.Əfəndiyev.

**NÁTRİUM** [*lat.*] Ağ rəngli yumşaq qələvi metal – kimyəvi element.

**NATÚRA** [*lat.*] 1. *inc.* Üzündən şəkli çəkilən təbii, canlı nümunə, yaxud şəklini çəkmək üçün rəssamın qabağında duran adam. [İndoneziya rəssamları] *nə çəksələr, demək olar ki, hamısı naturadandır, xalq həyatından alınmışdır.* M.İbrahimov. // Pavilyondan kənarda kinoşəkli çəkilən təbii şərait, yer. *Naturada çəkilən mənzərə.*

2. Ödənc vasitəsi kimi pul əvəzinə verilən mal, məhsul və s. borcunu natura ilə ödəmək.

**NATURAL** *sif.* [*lat.*] Natura (mal, məhsul və s.) ilə ödənilən, alınan və ya verilən (b a x **natura** 2-ci mənada). *Natural vergi.* ◻ **Natural təsərrüfat** – məhsulu satmaq üçün deyil, istehlakçının özünün istehlakı üçün istehsal olunan təsərrüfat.

**NATURALİST** [*lat.*] Naturalizm tərəfdarı.

**NATURALİZM** [*lat.*] XIX əsrin 60-cı illərin ədəbiyyat və incəsənətində meydana çıxmış burjua cərəyanı (bu cərəyan ictimai qanunları təbiət qanunları ilə eyniləşdirir, ictimai inkişaf qanunlarına etinasızlıq göstərir və varlığı ancaq zahiri cəhətdən, olduğu kimi, mexaniki cəhətdən təsvir etməyə çalışırdı). [“Koroğlu” operasının] *ümumi stili klassik stildir, bu stilə yabançı olan hər cür formalizm və naturalizm ünsürləri buraya qarışdırılmamışdır.* Ü.Hacıbəyov.

**NATÜRMÓRT** [*fr.*] Təsviri sənətdə (əsasən boyakarlıqda) janr; qrup halında və ya ayrılıqda çəkilmiş cansız şeylərin şəkli, rəsmi. *Mənzərə, natürmort, qrafika əsərləri .. sərgidə mühüm yer tutur.*

**NAÜMİD** *sif.* və *zərf* [*fars.*] Ümidsiz, ümidini itirmiş (halda). *Candan qəmin içrə naümidəm; Şəmşiri-cəfa ilə şəhidəm.* Füzuli. *Züleyxa gəlib ağlaya-ağlaya əhvalatı Aslana söylədi, o da naümid evə qayıtdı.* C.Cabbarlı. ◻ **Naümid etmək (eləmək)** – ümidsiz etmək, ruhdan salmaq, ümidini boşa çıxartmaq, ümidini kəsmək. *Əliqulu heç kəsə rədd cavabı vermirdi, heç kəsi naümid eləmirdi.* S.Rəhman. **Naümid olmaq** – ümidsiz olmaq, ümidini itirmək (kəsmək), ruhdan düşmək, əlini üzmək. [Qazı Xudayar bəyə:] *Əgər səndən bədgüman və naümid olsa idim, heç bu qədər danışmağa durmaz idim sənnən.* C.Məmmədquluzadə. *Fərəc yenə naümid olmadı.* Qantəmir.

**NAÜMİDCƏSİNƏ** *zərf* Ümidsizcəsinə, ümidsiz halda, ümidini itirmiş halda, ruhdan düşmüş halda. *Naümidcəsinə cavab verdi.*

**NAÜMİDLİK** *is.* 1. Ümidsizlik. *Naümidlik atəşinə yandım; Billah, bu vücuddan usandım.* Füzuli.

2. **Naümidliklə** şəklində *zərf* – b a x **naümidcəsinə**. [Məşədi Əsgər] *naümidliklə yenə öz evi tərəfə üz döndərib, Qanlıtəpə üstünə qayıtdı.* S.M.Qənizadə.

**NAVAXT** *is. köhn.* Qazamat, həbsxana. [Polis yasavulu:] *Xan, pristav buyurur ki, gələsiniz, .. kəndlinizə zamin olasınız, yoxsa zamini olmasa pristav göndərəcək navaxta.* C.Məmmədquluzadə.

**NAVALA** *is.* Undan, kəpəkdən hazırlanan mal-qara yemi. *Ağa gətirər navala, xanım tökər çuvala.* (Məsəl). [Xəlil:] *Qovurmanın ləzzəti elə ondadır ki, tikəni böyük götürüb dəvə navala udan kimi ötürəsən yerinə.* N.Vəzirov.

**NAVALÇA** *is.* Yağış, qar suyunun axması üçün damların kənarına qoyulan boru. *Eşik divardan asılı duran navalça, ən naşı adamın çaldığı dəf kimi, qeyri-müntəzəm bir səslə danqıldadı.* M.Hüseyn. *Sallanmış yaşadığım evin navalçasından; Fil dişi, fil xortumu, fil başı kimi buzlar.* S.Rüstəm. *Quşlar uçur yuvasına fırıl-fırıl; Şırıldayır navalçalar şırıl-şırıl.* M.Müşfiq.

**NAVAR**[1] *is.* Toxunma şeylərin kənarına tikilən parça. *Navarı olan cecim. Navar tikilmiş kilim.*

**NAVAR**[2] *is.* Heyvanı yüklədikdə belinə qoyulan içi küləşlə doldurulmuş torba; yəhəraltı.

**NAVARLI**[1] *sif.* Navar tikilmiş (b a x **navar**[1]). *Navarlı cecim.*

**NAVARLI**[2] *sif.* Belinə navar qoyulmuş (b a x **navar**[2]). *Navarlı at.*

**NAVİQÁSİYA** [*lat.*] 1. Gəmiçilik, dənizçilik.

2. İlin, yerli iqlim şəraitinə görə gəmilərin hərəkət etdiyi dövrü. *Naviqasiya qurtardı.*

3. Gəminin getdiyi yolu hesablamaq və onun dənizdə olduğu yeri müəyyənləşdirmək üsullarından bəhs edən elm. *Naviqasiyadan dərslik.*

**NAVİQÁTOR** [*lat.*] Naviqasiya (3-cü mənada) mütəxəssisi.

**NAY** b a x **ney**. *Çalınmaqda şeypurlar, naylar; Ucalmaqda ləşkərdən urraylar.* M.Ə.Sabir. *Oynatdı məni həm dəfə, həm naya bizim qız! Baxmaz nə o dünyayə, nə bu dünyayə bizim qız.* Ə.Nəzmi.

**NAZ** *is.* [*fars.*] 1. Özünü bəyəndirmək, istətmək məqsədi ilə edilən saxta, süni hərəkət; şivə, işvə, qəmzə. *Belə işvə, belə qəmzə, belə naz; Belə qamət, belə gərdən olurmu?* Q.Zakir. [Mirqasım:] *Matanda naz və şivə əsla yox idi.* Çəmənzəminli. ☐ **Naz eləmək (qılmaq, satmaq, göstərmək)** – nazlanmaq, əzilib-büzülmək, naz və işvə etmək. *Bir belə cavanın ağlı kəm olsa; Baxasan ki, sevgisinə naz eylər.* M.P.Vaqif. *Hərçənd xublərdə bu adətdi, naz olur; Sən tək və leyk naz qılan yar az olur.* S.Ə.Şirvani. *Qızlardan birisi naz sata-sata həkimə bir şey anlatmağa başladı.* Mir Cəlal.

2. B a x **naz-nemət**. [Nəsir] *istəyəcəkdi ki, qardaşı kimi naz və nemət içində yaşasın.* S.Hüseyn. *Ata-ana nazı ilə böyümüş Budaq indi çox şeyə tamarzı qalırdı.* Ə.Vəliyev.

3. *məc.* Nazənin, nazlı qız mənasında. *Qızdı, nazdı, min tümən azdı.* (Məsəl). [Nigar xanım:] *Düşər daşın, qalar leşin; Dağlar, üç nazı neylədiz?!* "Koroğlu".

4. Özünü bəyənməyən kimi göstərmə, bir şeyi qəbul etmək üçün özünə yalvarmağa, xahiş etməyə məcbur etmə (adətən "eləmək" feli ilə). *Naz eləyir, alacaq.* – [Sultan bəy:] *Yaxşı, yaxşı, naz eləmə, bilirəm ki, ürəyində sevinirsən.* Ü.Hacıbəyov.

5. Şıltaq, ərköyünlük. ☐ **...nazı ilə oynamaq** – ...dediyini eləmək, ...istəyinə əməl etməyə, hər tələbini, şıltağını yerinə yetirməyə çalışmaq. *Uşağın nazı ilə oynamaq.* – [Səlimə:] *Mən sənə ana olmuşam, bacı olmuşam, həmişə sənin nazınla oynamışam.* Ə.Haqverdiyev. [Vahidov:] *Şöhrət də övlad kimidir, Fizzə, olmayanda qüssəsini çəkirsən, olanda gərək nazıyla oynayasan.* Ə.Məmmədxanlı. **Nazını çəkmək** – çox əzizləmək, hər əziyyətinə dözmək, hər istəyinə əməl etmək. *Gözün gər içsə qanım nazını çəkmək münasibdir.* S.Ə.Şirvani. [Atabala Arazın] *hər nazını çəkir, hər şıltağına dözür.* A.Şaiq.

6. **Nazla** şəklində *zərf* – əzilə-əzilə, naz eləyərək, naz və qəmzə ilə, nazlı-nazlı. *Nazla danışmaq. Nazla yerimək.* – *Qərq olsun yaşıla, ala sərasər; Naz ilə sallana-sallana gəlsin.* Q.Zakir.

◊ **Özünü naza qoymaq** – əzilib-büzülmək, əda göstərmək, naz eləmək. *Qızlar Güldanədən oxumasını xahiş etdilər. O, əvvəlcə özünü naza qoydu, razı olmadı.* Ə.Vəliyev.

**NAZBALINC, NAZBALIŞ(I)** *is.* İçində təmizlənmiş, yumşaq quş tükü olan balış (yastıq). [Ata] *irəli gəlib süfrə başında salınmış döşəkcə üstə oturaraq, arxasına qoyulmuş nazbalışa söykənir.* H.Sarabski. *Onun qara, qıvrım və qalın saçları nazbalınca sərilmişdi.* S.Rəhimov.

**NAZBARI** *is. mus.* Ağır-ağır oynanılan Azərbaycan oyun havalarından birinin adı. *Nazbarı deyil ki, yeniyetmələr süzsün, Pərzad xala bacarmasın!* Mir Cəlal.

**NAZƏNDƏ** b a x **nazənin**. *Nazəndə dilbər. Nazəndə yar. Nazəndə gözəl.* // Şairanə təşbehlərdə. *Bu sualı verir mənə nazəndə bahar.* S.Vurğun. *Məhəbbətim səndə, könlüm səndədir; Bahar nə nazəndə, nə nazəndədir.* N.Rəfibəyli. *Boz dağları meşə örtdü, sahilləri gül; Bağ-bağçaya şeh çilədi nazəndə səhər.* Ə.Cəmil.

**NAZƏNİN** *sif.* [*fars.*] *şair.* Nazlı, işvəkar, cilvəli; incə və gözəl. *Sorma, heç sorma, nazənin Xavər; Məni məhv etdi iztirabü kədər.* H.Cavid. [Gəray:] *Günəş öz aləmində seyr edəli; Görməmiş böylə nazənin gözəli.* A.Şaiq. *Doğrusu, belə bir nazənin sənəmin sumkasının boş olmasına insafım yol vermədi.* Ə.Haqverdiyev. // İs. mənasında. *Ey nazənin, bu gen, geniş dünyada; Namusu əğyarə satmaq*

*nədəndir?* Qurbani. *Bu gün, bayram günü səhni-çəməndə; Gördüm nazəninlər xürrəm oturmuş.* Q.Zakir. *Salon. Qabaq sırada əyləşib bir nazənin; Əynindəki paltarı alışdım-yandımdandır.* R.Rza. // Gözəl, lətif, məlahətli. // Naz və nemət içərisində böyümüş, naz və nemətə alışmış.

**NAZƏNİN-NAZƏNİN** *zərf* İncə-incə, nazla. *Nazənin-nazənin edərsiz avaz; Ruh tazələnir, olur sərəfraz.* M.P.Vaqif.

**NAZİK** *sif.* [*fars.*] 1. Qalın, yoğun olmayan; incə. *Nazik kitab. Nazik təbəqə. – Maya nazik göy adyala bürünərək yuxulayırdı.* M.İbrahimov.

2. Yüngül, zərif materialdan hazırlanmış, qalınlığı az olan. *Nazik şüşə. Nazik parça. – Bibixanım .. nazik stəkanda kişiyə çay süzdü.* B.Bayramov. // En etibarilə, həcmcə kiçik olan, kiçik dairəli (*yoğun* müqabili). *Nazik məftil. Nazik sap. – Yelkənin dörd tərəfində vurulan nazik dirəklərdən işıqlı fanuslar asılmışdı..* M.S.Ordubadi. *..Külək ağacların ancaq nazik budaqlarını tərpədirdi.* H.Seyidbəyli. // Yüngül (*qalın* müqabili). *Nazik pencək. Nazik paltar. – Firəngizin əynində nazik kofta vardı.* B.Bayramov.

3. *məc.* İncə, zərif, qəşəng, gözəl. *Nazik bilək. Nazik barmaq. – Ağ nazik əlinlə bir dəstə bağla; Tər buxaq altında düz bənövşəni.* Qurbani. *Cismin nə nazikdir gül bədən kimi; Bir xoş qoxun gəlir yasəmən kimi.* M.P.Vaqif. // *məc.* Zəif, yüngül. *Gün yavaş-yavaş batmaqda idi, nazik yel əsirdi.* N.Nərimanov.

4. Arıq, cansız, cılız, zəif. *Qazızadədən sonra ucaboylu, qara, qıvrımsaçlı, nazik və arğazvücudlu Ənvər Rəşidli xitabət kürsüsünə yaxınlaşdı.* S.Rəhimov.

5. *məc.* İncətəbiətli, ədəbli, nəzakətli, incə. [Dəli Teymur:] *Hacı ağanın qarnının böyüklüyünə baxma, mirzə! Təbiətcə nazik adamdır.* H.Nəzərli. [Doktor] *şıq geyinmişdi, rəftarı mülayim və nazik idi.* Çəmənzəminli.

6. *məc.* İncə. [Qız:] *Dik-dik gözlərimin içinə baxaraq əvvəlkindən daha oğrun və nazik təbəssümlə dedi..* H.Nəzərli. *Gəldiyev ilə* [Vahidin] *arasında keçən ildən bəri davam edən nazik bir mətləbi oxucular bilməlidirlər.* Mir Cəlal. [Səməd] *öz nadanlığından və bu cür nazik mətləbi belə gec düşündüyündən özü-özünə acıqlandı.* B.Talıblı.

◊ **Nazik damarını bilmək (tanımaq)** – birinin xasiyyətinə, zəif cəhətinə incədən-incəyə bələd olmaq, yaxşı bilmək. *Gülsəhər ərinin nazik damarını bilirdi.* Ə.Vəliyev.

**NAZİKANƏ** *zərf* [*fars.*] Nazik, incə bir tərzdə, nəzakətlə, mədəni, ədəbli şəkildə, incəliklə. *Nazikanə rəftar etmək. Nazikanə qəbul etmək.*

**NAZİKBALDIR** *is. bot.* Sünbülə bənzər çiçək qrupu olan süpürgə tipli bitki cinsi. *Nazikbaldır cinsinin .. çiçək qrupu sünbülə bənzər süpürgə tiplidir. Sünbülcükləri 2-5 çiçəklidir.* H.Qədirov.

**NAZİKBEL(Lİ)** *sif.* Beli nazik, incəbel(li). *Nazikbel qız. –* [Budaq:] *Çavıstandan uzunboy, nazikbel bir arvad, iki uşaq çıxıb bizə tərəf gəldilər.* Ə.Vəliyev.

**NAZİKBƏDƏN(Lİ)** *sif.* və *is.* Nazik, incə, zərif bədəni olan. *Nazikbədən qız. – Bu yoldan gedən gözlər; Dayanar nədən gözlər; İntizardır, qoy gedim; O nazikbədən, gözlər.* (Bayatı).

**NAZİKBIĞ(LI)** *sif.* Nazik bığ qoymuş, nazik bığı olan. *Nazikbığlı kişi. – Əli ortaboylu, nazikbığlı, pəjmürdə tüklü bir student idi.* Çəmənzəminli.

**NAZİKCƏ** *sif.* 1. Çox nazik, olduqca nazik. *Nazikcə çubuq.*

2. *məc.* Çox incə, incəqəlbli, həssas, riqqətli. *Mürsəl öz dostu haqqında söhbətə ara vermədi: – Ana, Ataş nazikcə bir oğlandır* (*dedi*). Ə.Vəliyev.

**NAZİKDİŞ(Lİ)** b a x **narındiş(li)**. [Ana] *başımı dizinin üstünə qoyub gah sığallayır, hərdən də saçımı yuyub nazikdiş daraqla darayırdı.* Ə.Vəliyev.

**NAZİKDODAQ(LI)** *sif.* Dodaqları nazik olan. *Nazikdodaq qız.*

**NAZİKQABIQ(LI)** *sif.* Qabığı nazik olan. *Nazikqabıq nar. Nazikqabıq qoz.*

**NAZİKQAŞ(LI)** *sif.* Qaşları nazik, incə olan. *Nazikqaş gəlin.*

**NAZİKLƏNMƏ** "Naziklənmək"dən *f.is.*

**NAZİKLƏNMƏK** b a x **nazikləşmək**.

**NAZİKLƏŞDİRİLMƏ** "Nazikləşdirilmək"-dən *f.is.*

**NAZİKLƏŞDİRİLMƏK** *məch.* Daha da nazik hala salınmaq, daha nazik edilmək.

**NAZİKLƏŞDİRMƏ** "Nazikləşdirmək"dən *f.is.*

**NAZİKLƏŞDİRMƏK** *f.* Daha da nazik etmək, qalınlığını azaltmaq. *Taxtanı nazikləşdirmək. Yorğanı nazikləşdirmək.*

**NAZİKLƏŞMƏ** "Nazikləşmək"dən *f.is.*

**NAZİKLƏŞMƏK** *f.* 1. Nazik olmaq, nazik hala düşmək; incələşmək. [Bəziləri] *gecə evdə yatanda papaqlarını başlarından çıxartmırlar, bunun da nəticəsi bu olur ki, mürur ilə onların başlarının çanağı nazikləşir və kiçilir.* C.Məmmədquluzadə.

2. Arıqlamaq, cılızlaşmaq, zəifləşmək, incəlmək. [Rüxsarənin] *saralmış üzündə və çubuq kimi nazikləşmiş* (f.sif.) *qollarında ətdən bir əsər də qalmamışdı.* T.Ş.Simurq. [Tapdığın] *gün-gündən bət-bənizi saralır, qoluqıçı nazikləşirdi.* Ə.Vəliyev.

3. Getdikcə incələşmək, naziklənmək. *Sona uclara doğru nazikləşən* (f.sif.) *qalın qara qaşlarını çatıb dedi.* B.Bayramov.

**NAZİKLİK** *is.* 1. Nazik şeyin halı (*qalınlıq* müqabili). *Parçanın nazikliyi. Paltarın nazikliyi. – Hər şey nazikliyindən sınsa, insan yoğunluğundan sınar.* (Ata. sözü).

2. *məc.* İncəlik, həssaslıq, riqqət. *Naziklik ilə qönçeyi-xəndanı edən yad; Etməzmi həya ləli-dürəfşanını görgəc.* Füzuli. [Güldəstə:] *..Kərbəlayı, mən harda idim sən Zinət xanım ilə bu naziklikdə söhbət edəndə?* N.Vəzirov.

**NAZİKMƏZAC** *sif.* [*fars.* nazik və *ər.* məzac] Məcazı, təbiəti, xasiyyəti zərif, incə, xoş olan. *Nazikməzac adam.*

**NAZİKTƏR** *sif.* [*fars.*] *klas.* İncə, zərif. *Sona gər xidmət edən bir məhi-gül-peykər ola; Qaməti sərvdən əla, əli naziktər ola.* Aşıq Mirzə.

**NAZİKÜRƏK(Lİ)** *sif.* Ürəyi yumşaq, qəlbi nazik, tez riqqətə gələn; incəqəlbli. *Nazikürək adam. – Kəl Həsən çox nazikürək idi. Cavana dedi: – Ay cavan, qəm yemə, bu dəqiqə səni məşuqənə yetirərəm.* (Nağıl).

**NAZİKVÜCUD(LU)** b a x **nazikbədən(li)**. [Budaq:] *Ucaboy, nazikvücud Qarayev çox bikef idi*. Ə.Vəliyev

**NAZİKYARPAQ(LI)** *sif.* Yarpaqları nazik olan. *Nazikyarpaqlı kol.*

**NAZİL** [*ər.*]: **nazil olmaq** *klas*. – dini etiqadlara görə Allah tərəfindən göydən düşmək, gəlmək, enmək. *Allah-taalanın hər bir bəlası gərək bizim bədbəxt vilayətə nazil ola.* C.Məmmədquluzadə.

**NAZİLMƏ** "Nazilmək"dən *f.is.*

**NAZİLMƏK** b a x **nazikləşmək**. *Usta Ağabalanın saqqalı gicgahlarına getdikcə ucları nazilib gözəl surətdə qulaqlarına yapışırdı.* Çəmənzəminli. *Balaca qızın boğazı armud saplağı kimi nazilmişdi*. M.Hüseyn. *Qışqıra-qışqıra getdikcə qatar; Çay nazilir gözlərimdə.* O.Sarıvəlli.

**NAZİM** *is.* [*ər.*] 1. Nizama salan, tənzim edən, qaydaya salan. // b a x **nizamlayıcı** 2-ci mənada. *Nazim çarxı.*

2. *köhn.* Bir əhvalatı, hekayəti nəzmə çəkən; şair.

**NAZİR** *is.* [*ər.*] 1. Nazirliyə (1-ci mənada) başçılıq edən hökumət üzvü. *Maliyyə naziri. Maarif naziri. – Nazir onları öz kabinəsində qəbul etdi.* S.Hüseyn. *Bakıdan nazir kəndə gələndə birbaş maşını sürür tarlaya, kolxozçularla görüşür*. Ə.Sadıq.

2. Nəzarət edən, baxan, idarə edən; inspektor (2-ci mənada). *..Günlərin bir günü məktəbin naziri içəri girib uşaqlara deyir..* C.Məmmədquluzadə. *Birdən qapı açıldı, məktəbin naziri* (*inspektoru*) *qızarmış bir halda üzərimizə .. elə çığırdı ki, yoldaşlarımızdan bəziləri qorxularından ağlamağa başladı*. T.Ş.Simurq.

◊ **Hazıra (hazırına) nazir** – b a x **hazır**.

**NAZİRLİK** *is.* 1. Dövlət idarəsinin hər hansı bir sahəsinə rəhbərlik edən mərkəzi hökumət orqanı, habelə həmin idarənin yerləşdiyi bina, ev. *Maarif nazirliyi. Daxili işlər nazirliyi. Nazirlikdə işləmək*. – [Ümid] *sabah nazirliyə gedib əmrini alacaqdı.* B.Bayramov.

2. Nazir vəzifəsi (b a x **nazir** 1-ci mənada).

**NAZ-QƏMZƏ** *is.* [*fars.* naz və *ər*. qəmzə] İşvə, süzgün baxış, cilvə. *Atdı müjgan oxun, keçdi sinəmdən; Naz-qəmzələri canıma düşdü.* Aşıq Ələsgər. [Almaz:] *Canım, bir kəlmə danış onlardan, zalım uşaqlarının naz-qəmzəsi adamın əqlini aparır.* N.Vəzirov.

**NAZLAMA** "Nazlamaq"dan *f.is.*

**NAZLAMAQ** *f.* Əzizləmək, nazını çəkmək, oxşamaq, nəvaziş etmək. *Uşağı nazlamaq. –*

*Üstünə bəzəkli yumşaq taftadan; Alafa çəkərdi, nazlardı səni.* R.Rza.

**NAZLANDIRMA** "Nazlandırmaq"dan *f.is.*

**NAZLANDIRMAQ** *f.* Oxşamaq, nazını çəkmək, əzizləmək, nəvaziş etmək. [Mirzə Cəmil:] *Özü də* [ər] *elə adam olsun ki,* [Hürünü] *quş kimi yemləsin, nazlandırsın.* Ə.Vəliyev. [Ədhəm] *Nisəyə yaxınlaşdı, onu oxşamaq, nazlandırmaq xəyalına düşdü.* B.Bayramov.

**NAZLANMA** "Nazlanmaq"dan *f.is.*

**NAZLANMAQ** *f.* Naz eləmək, işvə etmək, naz satmaq. [Koroğlu:] *Qarı deyəndə tozlanır; Gəlin deyəndə nazlanır.* "Koroğlu". *Sara xanım bu sözdən sonra qara kirpiklərini bir-biri üzərinə tikərək nazlandı..* M.S.Ordubadi. *Qarşımda nazlanıb yenə gülürsən; Bilsən gülüşlərin nəyə bənzəyir?* M.Müşfiq. // Obrazlı təşbehlərdə. *Nazlandıqca sərin külək; Sahillərə sinə gərək.* S.Vurğun. *Ay gümüş dalğalarda nazlanır gəmi kimi.* N.Rəfibəyli.

**NAZLI** *sif.* Şivəli, qəmzəli, işvəli. *Adətdir aşiqin nazlı yar ilən; Arasında belə çəm-xəm olubdur.* Q.Zakir. *Alagözlü, nazlı dilbər; Elindən xəbərin varmı?* Aşıq Ələsgər. // Ərköyün, ərköyün böyümüş. *Nazlı qız.* // Obrazlı təşbehlərdə. *Bizə bu nazlı aləm görünərdi qaranlıq; Gözəl çalışmasaydıq, gözəl yaşamasaydıq*. M.Müşfiq.

**NAZLICA** "Nazlı"dan *oxş*. *Dolanım başına, ey nazlıca yarım, bəri bax; İşvəli, qəmzəli, çəm-xəmli nigarım, bəri bax*. S.Ə.Şirvani.

**NAZLI-DUZLU** *sif. dan.* İşvəli, qəmzəli, qanışirin, xoş, şux. *Nazlı-duzlu qız. Nazlı-duzlu gəlin*.

**NAZNAZI** *is. mus*. Ağır templi Azərbaycan oyun havalarından biri.

**NAZ-NEMƏT, NAZÜ NEMƏT** *is.* [*fars.* naz və ər. nemət] Tam firavanlıq, maddi rifah, səadət. [Alı kişi:] *Həsən xan, insan üçün dünyada hər naz-nemətdən şirin şey gözdür*. "Koroğlu". [Nüşabə:] *Durmayın, şahanə bir süfrə açın; Ortaya hər çeşid naz-nemət saçın!* A.Şaiq. // Var, var-dövlət, sərvət mənasında. *Dünyanın nazü neməti insan zəhmətinin başındadır, – deyə qoca bostançı öyünürdü.* S.Rəhimov. ☐ **Naz-nemət içində yaşamaq (bəslənmək, böyümək)** – həyatda heç bir şeydən çətinlik çəkməmək, firavan həyat keçirmək, xoşbəxt yaşamaq, var-dövlət içində bəslənmək. *Naz-nemət içində bəslənən bəxtiyarlar; Sanki deyirlərdi ki, yazıq, nəhayətin nə?* M.Müşfiq.

**NAZ-NƏVAZİŞ** b a x **nəvaziş**. [Nadir] *ağır və məsul çalışdıqdan sonra gəlib, evdə kimsənin naz-nəvazişini, mehriban rəftarını görmədiyini xatırladı.* B.Talıblı.

**NEANDERTAL** *is.* [*xüs.*] 250 min il öncə yaşamış qədim insan.

**NECƏ** 1. *zərf* Sual məqamında: nə təhər, nə cür. *Necə getdin? Necə gəlmisən? Onu necə gördün?* – [Sona xanım:] *Dan yeri ağarıb sabah indicə açılar, bilmirəm necə edim?* M.F.Axundzadə. [İskəndər:] *Hə... ana, kefin necədir?* C.Məmmədquluzadə. *Firidun: – Necəsiniz? – deyə qızın halını sordu..* M.İbrahimov.

2. *zərf* Nə dərəcədə, nə qədər (bəzən "də" ədatı ilə). *Bura necə sakitlikdir. Bu iş necə çətin işdir. Necə də gözəldir.*

3. *əd.* Heyrət, təəccüb ifadə edir. *Necə! Qayıtmışdır!.. Necə! Nə dedin? Necə! Bu sözü sən dedin?!*

4. *əd. dan.* ...kimi. *Necə bir dost sənə məsləhət görürəm.*

◊ **Necə yəni** – b a x **necə ki**. **Necə ki, necə də** – 1) cümlələri və ibarələri biri-birinə birləşdirən bağlayıcı söz. *Müsəlman papaqlarının ağırlığı, böyüklüyü və formaları Molla Nəsrəddinin dostlarına, necə ki, lazımdır, əyandır*. C.Məmmədquluzadə; 2) necə yəni, necə, necə olar ki. *Qəribə axmaq olubsan, necə ki, sən məni öz evimə qoymazsan..* İ.Musabəyov. **Necə gəldi** – tələsik, atüstü, başdansovma. *Necə gəldi işləmək. Şeyləri necə gəldi qoymaq*. **Necə olmuş olsa** – yenə də, hər halda, buna baxmayaraq. *Necə olmuş olsa, o bizim yoldaşımızdır.* **Necə olursa olsun** – nə vasitə ilə (nə yolla) olur olsun; hər halda, mütləq. [Zərrintac xanım:] *Şuşa qalasına yola düşməyi, necə olursa olsun* "*ayrı adamla*" *görüşməyi qət edirdi.* S.Rəhimov. **Hamı necə, mən də elə** – hamının etdiyi kimi, bir cür, bir qaydada, bir sırada. *Aslan köntöy-köntöy cavab verdi: – Getmirəm. Hamı necə, mən də elə.* M.Hüseyn.

**NECƏLİK** *is.* Xüsusiyyət, keyfiyyət. [Rüstəm kişi:] *Sən torpağın necəliyini məndən soruş, bala!* M.İbrahimov.

**NEÇƏ** 1. Əşyanın miqdarını müəyyənləşdirmək üçün işlədilən sual əvəzliyi: nə qədər, nə miqdar. *Neçə kitab aldın? Bu gün neçə yerə getmisən? Neçə şagirddən dərs soruşdun?* – [Məşədi İbad:] *Qardaşoğlu, haqq-hesabımız neçə elədi?* Ü.Hacıbəyov.

2. *əvəz.* Zaman bildirən isimlərdən əvvəl gələrək onların qeyri-müəyyənliyini bildirir. *Neçə yüz ildən sonra biz də o məqama çata bilərik.* C.Məmmədquluzadə. *Neçə dəqiqə idi, sakitlik bərpa idi.* Çəmənzəminli.

3. *əvəz.* "Saat" sözündən sonra gələrək vaxtı öyrənmək üçün sual məqamında işlədilir. *Saat neçədir? Saat neçədə gələcək?*

4. *əvəz.* Çox, çoxlu; bir neçə. [Əliməmməd Vaqifə:] *Neçə belə bayramlar görək, kefimiz kök, damağımız çağ olsun!* Çəmənzəminli. *Üstündə ahı var neçə qəribin; Çeşməli dağların, sulu dağların.* B.Vahabzadə.

5. *İs. mənasında.* Birdən artıq (çox) adam. *Şirvanın küçələri; Banlayır beçələri; Çağırdım öz yarımı; Hay verdi neçələri.* (Bayatı). *Neçəsinin əli dolu; Neçəsinin əli boşdur.* B.Vahabzadə. [Sərvnaz:] *Hümmət sənin* [Şahpəri] *fitvanla neçələrini gözümçıxdıya saldı?* B.Bayramov. ☐ **Bir neçə** – bir miqdar, qeyri-müəyyən miqdarda. *Bir neçə adam.*

6. **Neçəyədir**, **neçədəndir** şəklində – qiyməti nə qədərdir, bahası nədir. *Kitab neçəyədir? Parçanın metri neçəyədir?*

**neçə-neçə** *zərf* Bir çox, çoxlu, bir neçə. *Neçə-neçə ölkələr gəzib. Neçə-neçə illər gəlib keçib. Bu işin neçə-neçə səbəbləri var. – Neçə-neçə qərinələrdən bəri müsəlman elə xəyal eləyir ki, "şeytan" adında onun bir düşməni var.* C.Məmmədquluzadə.

**NEÇƏNCİ** 1. Əşyanın sırasını müəyyənləşdirmək üçün sual əvəzliyi; hansı? *Neçənci sinifdə oxuyursan? Neçənci mərtəbədə yaşayır?*

2. *Zərf mənasında.* Bir dəfə deyil, bir neçə dəfə; çox, təkrarən. *Neçənci gündür gəlib-gedir. Neçənci dəfədir zəng vurur.*

**NEÇİN, NEÇÜN** "Nə üçün" sual əvəzliyinin şeirdə və canlı dildə işlənən forması. *Təəccübəm ki, neçin rəhmə gəlmədin, zalım? Fəraq oduna yaxıb salmısan nə halə məni!* X.Natəvan. [Mehriban:] *Neçin gözləriniz xəyala daldı? Nə oldu rənginiz birdən saraldı?* S.Vurğun.

**NEFRİ́T** [*yun.*] *tib.* Böyrək iltihabı.

**NEFT** *is.* Yanacaq kimi işlədilən, habelə bir çox müxtəlif məhsullar (benzin, vazelin, parafin və s.) almaq üçün xammal kimi istifadə olunan, adətən tünd-qəhvəyi və ya qara rəngli yağlı mineral maye. ☐ **Ağ neft** – yanacaq kimi istifadə olunan təmizlənmiş neft.

**NEFTAYIRAN** *is.* Neftayırma sənayesi işçisi. *Neftayıranların yarışı.* // b a x **neftayırma**. [Zərifə] *sənət məktəbində oxudu, oranı qurtarandan sonra neftayıran zavoda işləməyə getdi.* H.Seyidbəyli.

**NEFTAYIRMA** *is.* və *sif.* Xam nefti üzvi hissələrinə ayırmaqla məşğul olan. *Neftayırma zavodu.*

**NEFTÇIXARAN** *is.* Neftçıxarma sənayesi işçisi. *Neftçıxaranlar bu gün təmirçilərin işindən çox razı qalmışdılar.* (Qəzetlərdən).

**NEFTÇIXARMA** *is.* və *sif.* Neft istehsalı ilə, neft çıxarılması ilə məşğul olan. *Neftçıxarma briqadası.* // Neft istehsalı ilə, neft çıxarılması ilə əlaqədar olan. *Neftçıxarma planı.*

**NEFTÇİ** *is.* 1. Neft sənayesi işçisi, həmçinin neft mütəxəssisi (mühəndis, texnik və s.). [Qüdrət:] *Sevmək lazımdır gəncləri! Onlardan qorxmaq, özgələrinə yaraşsa da, biz neftçilərə qətiyyən yaraşmır.* M.Hüseyn. *Xəzər gülür, min qat düşür göy sulara; Bir neftçinin alnındakı qatlar kimi.* Z.Tahir.

2. *köhn.* Neft alveri ilə məşğul olan, neft satan. *Neftçi dükanı. – Bakıda iri ticarətlə məşğul olan düyüçülər, xuşgəbarçılar, ipəkçilər, xalçaçılar, qara neftçilər də az deyildi.* H.Sarabski. [Müəllim:] *Yaxşı, otur. Sən oxu! Suçuya 3 manat 87 qəpik verilməlidir, neftçiyə 4 manat 20 qəpik.* Ü.Hacıbəyov.

**NEFTÇİLİK** *is.* Neftçinin işi, peşəsi.

**NEFTDAŞIYAN** *sif.* və *is.* Neft daşımağa məxsus (tanker, avtomobil və s.). *Ertəsi gün sübh tezdən Azad tacir Hacı Hadinin neftdaşıyan barjında Həştərxana yola düşdü.* A.Şaiq.

**NEFTLİ** *sif.* 1. Tərkibində neft olan; neft verən. *Neftli lay.*

2. Neftə bulaşmış, neftə batmış. *Neftli qab. Neftli əsgi. – Buruqların dörd tərəfində müxtəlif ölçüdə neftli, mazutlu borular...* M.İbrahimov.

**NEFTLİLİK** *is.* Neft vermə qabiliyyəti (torpaqda, yer laylarında). *Layın neftlilik dərəcəsi.*

**NEFTTƏMİZLƏYƏN** *sif. tex.* Nefti sudan ayıran. *Nefttəmizləyən qurğu.*

**NEHRƏ** *is.* Yağ çıxartmaq üçün içində qatıq çalxalanan saxsıdan və ya ağacdan qayrılmış uzunsov qab. *Çöldə hər övrəti-qarabaği; Nehrədə çalxayır gözəl yaği.* S.Ə.Şirvani. [Bahar:] *Axşamacan cəhrə əyir, inək sağ, qatıq çal, nehrə çalxa, adını da tənbəl qoysunlar.* Ə.Haqverdiyev.

**NEKROLOQ** *is.* [*yun.*] Ölən adamın həyat və fəaliyyəti haqqında məqalə-məlumat.

**NEKTÁR** [*yun.*] 1. Qədim yunan əsatirində allahlara əbədi gənclik və gözəllik verən içki; abi-həyat.

2. *bot.* Ali bitkilərdə çiçək ballıqlarının ifraz etdiyi şəkərli şirə.

**NEKTARİ** *is.* [*yun.*] *bot.* Ali bitkilərin güllərində nektar ifraz edən orqan.

**NEQATÍV** [*lat.* negativus – mənfi] Foto lövhəciyində və ya lentində bir şeyin tərsəsinə (ağın qara və qaranın ağ) düşmüş şəkli, həmçinin bu cür şəkil düşmüş fotoplastinkası və ya fotolenti.

**NEMES** [*rus.* немец] b a x **alman**. *Qırdırma nemes xalqını haqsız yerə, zalım; Bir gün gələcək, qorx o cəza məhkəməsindən.* Ə.Vahid.

**NEMƏT** *is.* [*ər.*] 1. Yaşamaq üçün lazım olan şeylərin məcmusu (yeyəcək, içəcək və s.); rifah. *..Bazar-dükanda cəm olan dünyanın hər bir neməti yeməli və içməli qəbilindən – hamısı həməvaxt şəhər əhli üçün mühəyyadır.* C.Məmmədquluzadə.

2. *məc.* Xoşbəxtlik, səadət, yaxşılıq. [Heydər bəy:] *İki il çöllərdə dərdinlə gün keçirib axır ki, arzuma yetişdim. Bu nemətin şükrünü yerinə yetirə bilmənəm.* M.F.Axundzadə. *Sözüm oradadır ki, doğrudan uşaqlıq bir gözəl nemət imiş ki, əldən çıxdı.* C.Məmmədquluzadə.

**NEN** *is.* Nen, Yamal-Nen və Rusiya Federasiyasına daxil Taymır milli mahallarının əsas əhalisini təşkil edən xalq və bu xalqa mənsub adam.

**neo**... [*yun.* neos – yeni] Bir sıra xarici sözlərin (isim və sifətlərin) qabağında, onlara yenilik mənası verən önlük; məs.: neolit, neologizm və s.

**NEOANTROP** *is.* [*yun.*] Müasir insan növünün ümumiləşdirilmiş adı.

**NEOLÍT** [*yun.* neos – yeni və lithos – daş] Daş dövrünün axırıncı epoxası, yeni daş dövrü.

**NEOLOGİZM** [*yun.* neos – yeni və logos – anlayış] *dilç.* Dildə yeni əmələ gəlmiş söz və ya ifadə.

**NEÓN** [*yun.* neos – yenidən] Havanın tərkibinə daxil olan rəngsiz və iysiz qaz – kimyəvi element (elektrik lampalarında, siqnal, reklam və s.-dəki işıqlandırıcı cihazlarda işlədilir). □ **Neon lampası** – içi neonla doldurulmuş qaz lampası – işıq cihazı (siqnalizasiya, reklam və s.-də işlədilir).

**NÉPMAN** [*rus.* нэп – новая экономическая политика (yeni iqtisadi siyasət) və *alm.* Mann – adam] *tar.* Yeni iqtisadi siyasət dövründə meydana gəlmiş sahibkar, alverçi.

**NEPTÚN** *is.* [*lat.*] 1. Günəş sisteminin Günəşdən məsafəsinə görə səkkizinci planeti.

2. Qədim Roma mifologiyasında bulaqlar və çaylar allahı.

**NERV** [*lat.*] *dan.* Sinir, əsəb. *Burada Gülzarın artıq bütün nervləri, bütün ilikləri parçalanıb, boğuq səslə inlədi.* C.Cabbarlı.

**NEŞTƏR** *is.* [*fars.*] 1. Sancan heyvanlarda (əqrəb, arı və s.-də) sancdıqları yerə zəhər buraxmaq üçün orqan. *Əqrəb kimi neştər gücü var dırnağımızda.* M.Ə.Sabir. // Məc. mənada. *Allah yaman gözdən saxlasın, gözəl ceyildir. Düşmən gözünün neştəridir.* M.S.Ordubadi.

2. Yaranı, çibanı və s. yarmaq, deşmək üçün ikiağızlı, itiuclu cərrah bıçağı. [Kəlbalı] *yəhərqaş xurcunda həmişə neştər və biz gəzdirər.* S.Rəhimov. *Zabit elə bağırdı ki, sanki .. yetişmiş çibanına neştər soxdular.* Ə.Vəliyev □ **Neştər kimi** – ucu çox iti şey haqqında. ..[Qızın] *kirpikləri isə bir neştər kimi göz bəbəklərini yarmağa çalışırdı.* M.S.Ordubadi. ..[Qızın] *bu yanıqlı sözləri və kədərli baxışı qocanın qəlbinə neştər kimi sancıldı.* A.Şaiq. **Neştər vurmaq** – b a x **neştərləmək**. *Aşiqəm bir dəm ara; Neştər vur bir damara; Məni zülfün vurubdu; Vurdurma bir də mara.* (Bayatı).

**NEŞTƏRLƏMƏ** "Neştərləmək"dən *f.is.*

**NEŞTƏRLƏMƏK** *f.* 1. Neştərlə deşmək, kəsmək, yarmaq. *Xan Əsliyə həsrət qoydun Kərəmi; Xəncər alıb neştərlədin yaramı.* Aşıq Kərəm.

2. *məc. dan.* Sancmaq, acılamaq. *Arı əlimi neştərlədi.* // Məc. mənada. [Xanpəri:] *Səndən*

*söz soruşurlar, .. əvvəlcə cavab ver, sonra başla neştərləməyə.* Ə.Vəliyev.

**NEŞTƏRLƏNMƏ** "Neştərlənmək"dən *f.is.*

**NEŞTƏRLƏNMƏK** *məch.* Neştərlə deşilmək.

**NEŞTƏRLİ** *sif.* Neştəri olan. *Neştərli heyvanlar* (*arı, əqrəb və s.*).

**NÉTTO** [*ital.*] 1. Əmtəənin qabsız xalis kütləsi.

2. İtkilər, ayırmalar və s. çıxıldıqdan sonra mənfəətin, büdcənin həcmi.

**NEVRALGÍYA** [*yun.* neuron – damar və algos – ağrı] Hər hansı bir sinirin və onun qabığının zədələnməsi nəticəsində həmin sinirin keçdiyi yerdə əmələ gələn ağrı.

**NEVRÍT** [*yun.*] *tib.* Zədə, soyuqdəymə, infeksiya və s. nəticəsində törəyən sinir iltihabı.

**NEVROLÓGİYA** [*yun.* neuron – damar və logos – elm] Sinir sistemi və onun xəstəliklərindən bəhs edən elm.

**NEVRÓZ** [*yun.*] Daxili üzvlərin funksiyalarının, mübadilə prosesinin pozulması və s. şəklində təzahür edən mərkəzi sinir sistemi xəstəliyi. *Ürək nevrozu. Ümumi nevroz.*

**NEY** *is.* [*fars.*] 1. Qarğıdan, qamışdan düzəldilən, nəfəslə çalınan musiqi aləti. *Çobanın çaldığı neyin səsi də qoyun mələşmələrinə qarışaraq bir musiqi ansamblını xatırladır.* M.S.Ordubadi. *Sahildə ağ yelkənli qayıqda xidmət edən dəstədən ney səsi ətrafa yayılırdı.* S.Rəhimov. ☐ **Ney kimi (təki)** – həzin-həzin, yanıqlı. *Bənd-bəndim kəsələr eyləmərəm tərki-fəğan; Qoy nəva ney tək edim ta nəfəsim var mənim.* S.Ə.Şirvani. // Qamış, qarğı.

2. Qəlyanın, çubuğun, müştüyün ağıza salınan hissəsi, ağızlığı. [Hikmət İsfəhani] *qəlyanın neyini əlinə aldı və dodağına yapışdırıb xoruldatdı.* M.İbrahimov.

**NEYBƏT** *is.* [*ər.*] Çirkin, kifir, eybəcər. *Ağ üzdə qara xal ziynətdir, qara üzdə ağ xal – neybət.* (Ata. sözü). *Az qalır doxsana çatsın yaşı neybət kişinin; Varlığı bağrımı çatlatdı bu heybət kişinin.* M.S.Ordubadi.

**NEYBƏTLİK** *is.* Çirkinlik, kifirlik, eybəcərlik. [Ələkbər:] *Yox canım! Qumru hara, belə kifirlik, neybətlik hara!* Mir Cəlal.

**NEYÇİ** *is.* Ney çalan musiqiçi.

**NEYİSTAN** *is.* [*fars.*] *klas.* Qamışlıq, çoxlu qamış bitən yer. *Üz qoyuram gah neyistanlara; Bir sürü aslan görürəm, qorxmuram.* M.Ə.Sabir. *Əsdikcə neyistanə bütün rəşə salır bad; Min nəğmeyi-cansuz edər ol nəğmələr icad.* A.Səhhət.

**NEYLÓN** [*ing.*] Süni lif növü, habelə lifdən toxunmuş parça. // Belə lifdən toxunmuş. *Neylon kofta. Neylon paltar. – Naznaz atlaz paltarını yığıb, neylon corablarda işıldayan qılçalarını qabağa verərək maşından çıxır.* M.İbrahimov.

**neyro**... [*yun.*] Sinir sisteminə aid mürəkkəb sözlərin tərkib hissəsi; məs.: nevralgiya, nevropotologiya, nevropsixologiya və s.

**NEYRÓN** *is.* [*yun.*] Sinir sisteminin əsas funksional və quruluş vahidi.

**NEYSAN** b a x **niysan**. *Biri nökər, biri ağa; Göydən yerə neysan yağa.* Aşıq Əli. *Dağa qalxır dumanlar; Tez-tez yağır neysanlar.* A.Səhhət.

**NEYTRÁL** [*lat.* neuter – nə o, nə bu] 1. *kim.* Nə turşu, nə qələvi reaksiyası verməyən. *Neytral məhlul.*

2. *xüs.* Orqanizmə nə müsbət, nə də mənfi təsir edən (maddə, dərman və s. haqqında).

**NEYTRALLAŞDIRICI** *is.* və *sif. kim.* Neytral edən, neytral hala salan, neytrallaşdıran (b a x **neytral**).

**NEYTRALLAŞDIRMA** *kim.* "Neytrallaşdırmaq"dan *f.is.*

**NEYTRALLAŞDIRMAQ** *f. kim.* Məhlulun turşu xassəsini qələvi, qələvi xassəsini isə turşu vasitəsilə yox etmək.

**NEYTRALLAŞMA** "Neytrallaşmaq"dan *f.is.*

**NEYTRALLAŞMAQ** *f. kim. fiz.* Neytral hala keçmək, neytral olmaq (b a x **neytral**).

**NEYTRÓN** [*lat.* neutum – nə o, nə bu] Atomun nüvəsinin tərkibinə daxil olan elektrik yükündən məhrum hissəcik.

**NƏ**[1] 1. *sual əvəz.* Bu və ya digər əşyanı, vəziyyəti, halı, hadisəni müəyyənləşdirmək üçün sual məqamında işlədilir. *Nə dedin? Nə olan işdir? Nə olub? Bu nə evdir?*

2. *əvəz.* Təsdiq bildirən feillərə inkarlıq mənası verir. [Uğur:] *Səndən yaxşılıqdan başqa nə görmüşəm?* İ.Əfəndiyev.

3. *əd.* Danışan şəxsin bir şeydən məmnunluğunu, o şeyin ürəyindən olduğunu bildirir. *Nə ürəyimdən dedin? Nə yaxşı əsərdir? Qız nə qız? – Qədir yenə də əyilib baxırdı. Dərə nə dərə!* Mir Cəlal.

4. Cəm şəkilçisi ilə: "hər şey", "hər nə istəsən" mənasında. *Burada nələr yoxdur. O səndən nələr dedi. – Bu yoldan gələr, keçər; Ahular mələr, keçər; Oğulsuz anaların; Qəlbindən nələr keçər.* (Bayatı). *Nələr bitmir, nələr yoxdur torpağımızda.* S.Rüstəm.

5. Şəxs əvəzliklərindən sonra gələrək onlara inkarlıq mənası verir. *Ona nə. Sənə nə.* – [Növbətçi:] *Mənə aid bir şey yoxdur. Şəhər stansiyası satıb, mənə nə?* Mir Cəlal.

6. Çıxışlıq halında "niyə", "nə üçün", "nə səbəbə", "niyə görə", "nədən" suallarını əvəz edir. *Əzizim, qandı ürək; Yar sözün dandı ürək; Şirin şərbət içirtdin; Nədən bəs yandı ürək?* (Bayatı).

7. "İsə" qoşması ilə qeyri-müəyyənlik bildirir. *Təcrübəli Fərhadoğlu vurnuxur, nə isə qəti bir qərara gələ bilmirdi.* S.Rəhimov. *Əbil Qənbərovun çıxışı .. adamlarda nə isə bir donuqluq əmələ gətirdi.* Ə.Vəliyev.

8. "Var" sözü ilə "heç nə", "heç zad" mənası verir. *Meyvəsiz bağda nə var? Bəhrəsiz tağda nə var? Məcnun xəyallı könlüm; Leylisiz dağda nə var?* (Bayatı).

9. Xəbər şəkilçisi ilə "nədir?" formasında sual kimi işlənir. [Ata:] *Çarəsiz mağaraya girdim, bir də ağır bir xorultudan gözlərimi açdım: – Bu nədir? Məndən başqa burada adammı var? – dedim.* A.Şaiq. *Səlim indi Mehribana sanki fəlsəfə dərsi verirdi: həyat nədir, ölüm nədir – onu anladırdı.* S.Hüseyn.

◊ **Nə bilim** – deyə bilmərəm, bilmirəm. [Qədir:] *Ay bəy, Məşədi Ələkbər deyir, nə bilim, yüzbaşı özü də bizə baxır.* Mir Cəlal. **Nə borcuma (borcuna), nəyimə (nəyinə) gərək** – b a x **nə borcum(a), nə borcun(a), nə borcumuzdur, borcundur** ("**borc**"da). **Nə çarə** – b a x **çarə**. ...**Nə desən çıxar** – xatakar, pis əməlli adam haqqında. [Sona:] *Hə, onlardan nə desən çıxar.* Ə.Əbülhəsən. **Nə deyim** – b a x **demək**[1]. **Nə əcəb** – b a x **əcəb**. *Sual və təəccüblə onun üzünə baxa-baxa dedi: – Nə əcəb, Vahid? Nə əcəb? Bu vaxt?* Mir Cəlal. **Nə fayda** – b a x **fayda**. *Ancaq nə fayda; Özü yıxılanın ağlamağından!* B.Vahabzadə. **Nə hə, nə yox** – b a x **hə**. **Nə isə** – xülasə, müxtəsər, sözün qısası. *Nə isə, Məsmənin yeganə əziz oğlu haqqında şirin xatirələri tükənməz idi.* Mir Cəlal. **Nə ki** – hər nə qədər, nə qədər, mümkün qədər. *Nə ki gözəl görmüşəm mən; Hamısından başdı Gözəl.* Aşıq Ələsgər. [Hacı:] *Şamaxılı Şamaxıdan, gəncəli Gəncədən, şəkili Şəkidən nə ki imkan var hümmət eləyək...* Mir Cəlal. **Nə lazım** – əbəsdir, dəyməz, ehtiyac yoxdur. *Nə lazım işi böyütmək.* **Nə olar** – hər ehtimala qarşı. *Demək nə lazımdı, özün bilirsən; Bir gün yaranırsan, bir gün ölürsən.* Aşıq Ələsgər. **Nə olar, nə olar ki, nə olaydı** – ümid, arzu, istək mənasında işlənir. *Nə olaydı mənim də adım xoşbəxtlər cərgəsində çəkiləydi. – Nə olar ki, hamıya məlum olan düşmənlərimizi bir saatlığa qoyaq kənara.* C.Məmmədquluzadə. *Nə olardı* [Əntiqəni] *də bu dərs otağına buraxaydılar, oturmağa qoyaydılar.* Mir Cəlal. *Könüllü gəlmədik bu dünyaya biz; Nə olar, dünyadan könüllü getsək?..* B.Vahabzadə. **Nə olar, olar** – gözlənilən təhlükə və ya hadisə, iş qarşısında işlədilir. [Əsgər:] *Daha burada dayanmaq namərdlikdir, Mütəllim! Vuraq özümüzü çaya. Nə olar, olar.* Ə.Vəliyev. **Nə olursa olsun** – hər necə olsa, hər nə olsa da, mütləq. *Ey gənc! Səadəti bir xəyal bilmə; Nə olursa olsun, ancaq əyilmə!* S.Vurğun. *Durnanı möhkəm qucmuş Xasay bu il nə olursa olsun toy etmək, fikrində idi.* Ə.Vəliyev. **Nə sənə, nə mənə** – heç bir şeyi nəzərə almadan, hesablaşmadan, gözləmədən. *Adilə nə sənə, nə mənə, birdən anasının üstünə qışqırdı.* Ə.Məmmədxanlı. **Nə təhər (tövr)** – b a x **təhər**. *İmzalarla deyil, gözlə görsünlər; Ağlın duruluğu nə təhər olur; Hökmün bulanlığı nə təhər olur.* M.Araz. **Nə üçünsə** – səbəbi məlum olmadan. *Nə üçünsə cavab vermədi. Nə üçünsə üzünü yana çevirdi. – Bəyim bilet alıb geri dönəndə bizi görüb nə üçünsə qızardı.* İ.Əfəndiyev. **Nə üzlə** – b a x **üz**. *Mən onun yanına gedim nə üzlə; Oyunlar oynadı bu dünya bizlə.* S.Tahir. [Bəy:] *Pristavın yanına bəs nə üzlə gedəcəksən?* Mir Cəlal. **Nə var, nə yox** – b a x **var**[1]. **Nə yaxşı** – b a x **yaxşı**. *İllər həsrətinə dözən şerimiz; Köhnəldi nə yaxşı, susdu nə yaxşı.* M.Araz.

**NƏ**[2] *bağl.* Sadə cümlələrdə həmcins üzvləri, mürəkkəb cümlələrdə isə onun tərkibinə daxil olan cümlələri bir-birinə bağlayır (əsasən təkrar edilərək işlədilir, və, də, də ki bağlayıcılarından biri artırılır). *Nə şiş yansın, nə kabab*. (Məsəl). *Nə göz görsün, nə ürək bulansın*. (Məsəl). [Yusif:] *Nə yorğan və nə döşək, nə də balış və nə də pul vardır*. N.Nərimanov. *Nə bir işıq görünür, nə də bir həyat səsi eşidilirdi*. C.Cabbarlı. *Səltənət nə döndü, nə tərpəndi, nə də ki cavab verdi*. Mir Cəlal.

**NƏBADƏ** [*fars.*] *dan.* b a x **məbadə**. [Dəşgüvar:] *Gərək siz evləri gəzib, taza anadan olan oğlan uşaqlarını oğurlayıb öldürəsiz. Amma nəbadə camaat bilə.* (Nağıl). [Ana:] *Yola salanda dedim, oğul, düşmənə nəbadə arxa çevirəsən, südüm sənə .. haram olar.* Ə.Əbülhəsən.

**NƏBAT** *is.* [*ər.*] *klas.* Bitki.

**NƏBATAT** *is.* [*ər.* "nəbat" söz. cəmi] 1. Bitki, bitki aləmi. *Səbr ilə verir zəmin nəbatat*. Xətayi. *..Nə olardı insan da bu nəbatat kimi, qış daxil olanda yuxuya gedib, bahar vaxtı bədənində təzə bir qüvvət olaraq oyana idi!* Ə.Haqverdiyev.

2. B a x **botanika**. *Radioaktiv elementlərin nəbatatda, təbabətdə, sənayedə necə tətbiq olunduğundan* [İkramın] *az-çox məlumatı var idi.* Ə.Əbülhəsən.

**NƏBATATÇI** b a x **botanik**.

**NƏBATATŞÜNAS** [*ər.* nəbatat və *fars.* ...şünas] b a x **nəbatatçı**.

**NƏBATİ** *sif.* [*ər.*] 1. Nəbata aid olan, bitkidən alınan, bitki mənşəli.

2. Nəbat (bitki) şəklində olan. *Nəbati ornament. Nəbati naxış.*

**NƏBİ** *is.* [*ər.*] *klas.* Peyğəmbər. *Ya nəbi, lütfün Füzulidən kəm etmə..* Füzuli.

**NƏBZ** *is.* [*ər.*] 1. Ürəyin fəaliyyəti nəticəsində arteriya (qan damarları) divarlarının ritmik vurması (adətən biləyin yuxarı hissəsində duyulur). *Bir naxoşun üstə həkim gətirəndə həkim əvvəl yapışır naxoşun nəbzindən*. C.Məmmədquluzadə. [Mirzə Mehdi] *sonra gəlib Fərmanın yastığının yanında əyləşib nəbzini tutdu*. Ə.Haqverdiyev. // Biləkdə həmin titrəyişin hiss edildiyi yer. *Nəbzini yoxlamaq. – Şair içəri girib salam verdi, Mədinənin taxtının üstündə oturub nəbzinə baxdı.* Çəmənzəminli.

2. *məc.* Bir şeyin (hadisənin, həyatın və s.) ritmi, tempi. *Deyirlər ki, gələcək ancaq zamanın nəbzini düz tutanların, bu günü yaxşı anlayanlarındır.* M.İbrahimov. [Xanmuradov:] *Mən buraya baxarkən həmişə əsrimizin nəbzini duyaram.* Ə.Sadıq. [Lalə] *dördüncü buruğun nəbzini bir an əlindən buraxmaq istəmirdi*. M.Hüseyn.

**NƏCABƏT** *is.* [*ər.*] Nəciblik, əsillilik, təmiz bir nəslə mənsubiyyət, soyluluq. [Naçalnik:] *Oğlan, sözünü de, nəcabətini isbat eləmək qoy sonraya qalsın?* M.F.Axundzadə. *Qoy nə əslin, nəcabətin olsun; Nə nəcibanə halətin olsun.* M.Ə.Sabir. [Nəcəf bəy:] *Mənim əslim və nəcabətim heç vədə qəbul eləməz ki, mənim evimə it-qurd qızı gəlsin.* Ə.Haqverdiyev.

**NƏCABƏTLİ** *sif.* Təmiz və əsil bir nəslə mənsub olan; soylu, əsilli, əsilli-nəsəbli, adlı-sanlı. *Nəcabətli adam*. – [Leyli:] *İbn-Salam, sən nəcabətlisən, uca ruhlusan, sən mənə zülm etməyi rəva görməzsən*. Ə.Məmmədxanlı.

**NƏCAT** *klas.* b a x **nicat**. *Ey mənşəyi-cövhəri-həyatım; Xoşnudluğundadır mənim nəcatım!* Füzuli. *..Min il yuxuda olan camaat hökumətin əsarət zəncirini qırıb, özləri üçün bir nəcat yolu tapsınlar.* C.Məmmədquluzadə.

**NƏCCAR** *is.* [*ər.*] *köhn.* Dülgər, xarrat.

**NƏCCARLIQ** *is. köhn.* Dülgərlik, xarratlıq.

**NƏCİB** *sif.* [*ər.*] 1. Nəcabəti, əsli olan; əsilli, soylu, nəcabətli. [Heydər bəy:] *Amma sizə lazımdır ki, bizim kimi nəcib kimsənələrə bir çörək yolu göstərəsiniz.* M.F.Axundzadə. [Həsən:] *Kişi nəcib nəsildən olduğunu hamıya apaçıq göstərdi.* Ə.Haqverdiyev.

2. Alicənab, yaxşı, ürəyi təmiz. [Gülçöhrə:] *Arşınmalçının üzü nəcib adamın üzünə oxşayır*. Ü.Hacıbəyov. *Silistçi Sədrəddin bəy yaxşı, nəcib adamlardan birisi idi*. S.M.Qənizadə. *Üz-gözündən bilinir ki, qonağın nəcib oğlandır*. M.Hüseyn. // İs. mənasında. [Rəhim:] *Belə olan surətdə rüsxət ver, gedim, sübut gətirim ki, mən özüm də nəciblərdənəm.* N.Vəzirov.

3. *məc.* Təmiz, pak, müqəddəs. *Nəcib duyğu. Musiqi yüksək, nəcib hisslər ifadə edir. – Bəsləyirəm mən səni nəcib əməllərimlə; Deyirəm ki, bağban ol bizim bu gözəl bağa*. S.Rüstəm. *Yeni sədrin cəsarətli sözləri, nəcib*

*arzuları Həbibə bir az qəribə görünsə də, Mədədin bugünkü söhbəti ona bərk təsir eləmişdi.* Ə.Vəliyev.

4. *məc. dan.* Qəşəng, gözəl, incə, zərif. *Nəcib üz* (*sifət*). – [Qızın] *uzun, nəcib barmaqlarına diqqət edir, fikrinə gəlir ki, bu barmaqlar sənət üçün yaranmışdır*. Mir Cəlal.

◊ **Nəcib qazlar** – adətən başqa qazlarla kimyəvi reaksiyaya girməyən qazlar. **Nəcib metallar** – havada oksidləşməyən metallar (qızıl, gümüş, platin).

**NƏCİBANƏ** *sif.* [*ər.* nəcib və *fars.* ...anə] Nəciblərə məxsus, nəcib adamlar kimi. *Nəcibanə sifət. Nəcibanə təbiət. – Qoy nə əslin, nəcabətin olsun; Nə nəcibanə halətin olsun*. M.Ə.Sabir. *Ağuşi-nəcibanədə, aldanma, yerin yox! Gər Qeys ilə həmdərdi-biyaban ola bilsən.* C.Cabbarlı. // Zərf mənasında. *Nəcibanə danışmaq. Nəcibanə hərəkət etmək.*

**NƏCİBCƏSİNƏ** b a x **nəcibanə**.

**NƏCİBLƏŞMƏ** "Nəcibləşmək"dən *f.is.*

**NƏCİBLƏŞMƏK** *f.* Nəcib olmaq, incələşmək, zərifləşmək, qəşəngləşmək.

**NƏCİBLİK** *is.* 1. Nəcabət, əsillilik, alicənablıq. *..Mən Bahadırın nəcibliyinə, kamalına ümid bağlayıb, yəqin edirdim, birlikdə çarə tapıla.* N.Nərimanov. *Musa yoldaşları arasında qorxmaz və cəsur olması ilə, nəcibliyi və mərdliyi ilə seçilirdi.* Ə.Vəliyev.

2. *məc.* Zəriflik, incəlik, qəşənglik, gözəllik.

**NƏÇİ** *əvəz.* Birinin sənətini, peşəsini, məşğuliyyətini bilmək üçün sual məqamında işlədilən söz. *Bir qız tanıyırdım. Lakin nə adını bilirdim, nə də kim və nəçi olduğunu öyrənə bilmişdim*. S.Hüseyn. // Eyni mənada **nəçidir? nəçisən?** şəklində. [Sultan bəy:] *De yaxşı, bir məni başa sal görüm, sən kimsən, nəçisən və kimin adamısan?* Ü.Hacıbəyov.

**NƏDAMƏT** [*ər.*] 1. *is.* Peşmanlıq, peşman olma. *Əyyaşlığın sonu yorğunluq və nədamət, səfalətin – heçlik və fəlakətdir...* A.Şaiq. □ **Nədamət çəkmək** – peşman olmaq, peşmançılıq çəkmək. *Lalə yanağından, nərgiz gözündən; Qönçə gülüşündən nədamət çəkər.* Aşıq Valeh.

2. **Nədamətlə** şəklində *zərf* – peşmanlıqla, peşmançılıqla. *Şirin .. dərin bir nədamətlə pıçıldadı*. İ.Əfəndiyev.

**NƏDƏN** *əvəz*. Nə üçün, nə səbəbə, nəyə görə, niyə? *Nədən saralıbsan sən də mən kimi; Nədir dərdin, ey biçarə şamama?* M.P.Vaqif. *Fələ, mənə bir söylə, nədən hörmətin olsun? Axır nə səbəb söz deməyə qüdrətin olsun?!* M.Ə.Sabir. □ **Nədən ki, nədəndir ki** – çünki, o səbəbə ki. *Mirzə Çopurov da oxuya bilməyibdir, nədən ki, külək kağızı cırıq-cırıq eləmiş*(*di*). S.Rəhimov.

**NƏDƏNSƏ** *zərf* Nə səbəbə görə isə, nəyə görə isə. [Kərim baba:] *Hətta qurdu nişan alıb vurmaq istədim. Nədənsə fikrimdən vaz keçdim.* A.Şaiq. *Mehriban .. ona "Mehriban bacı!" – deyə xitab edən Səlimdə nədənsə bir səmimiyyət görürdü*. S.Hüseyn.

**NƏDİM** *is.* [*ər.*] *köhn.* 1. Sirdaş, yaxın adam, dost, həmsöhbət, həmməclis. *Gördü ki, gəlir nədimi-kamil*. Füzuli.

2. Keçmişdə şahların, xanların məclislərində gülməli sözləri və hərəkətləri ilə onları əyləndirən adam – təlxək. *Padşahın nədimləri, məzhəkəçiləri onu əyləndirmək üçün gülməli nömrələr hazırlayır və məşq edirdilər.* M.S.Ordubadi.

**NƏDİMƏ** [*ər.* nədimət] *köhn.* "Nədim"in qadın cinsi (b a x **nədim** 2-ci mənada). [Mirzə:] *Həmin Kərbəlayı Kazımın arvadı on ildir ki, hacının evində işləyir, özü də xanımın nədiməsidir.* P.Makulu.

**NƏF** *is.* [*ər.*] *klas.* Xeyir, fayda, mənfəət. [İzzət:] *Görək Xudayar bəynən sənin nə alıb-verəcəyin var? Katdadı özünə katdadı. Görək* [Xudayar bəyin] *katdalığının sənə bir nəfi var?* C.Məmmədquluzadə. *Şəhər məktəbində təlim alan fəqir şagirdlərin nəfi üçün müəllimlərin hümməti ilə .. bir komediya göstərildi.* F.Köçərli. □ **Nəf etmək (eləmək)** – qazanmaq, fayda götürmək, xeyir görmək. *Sən bizi nəfə etmədin vasil; Bari qoy özgə elm edək hasil.* S.Ə.Şirvani. *O il Ağa Hüseyn çox böyük nəf elədi və bu nəfi də Xəlilin ayağının sayəsindən hesab edirdi*. Ə.Haqverdiyev.

**NƏFBƏRDAR** *sif.* [*ər.* nəf və *fars*. ...bərdar] *köhn.* Xeyir görən, faydalanan, mənfəət götürən. □ **Nəfbərdar olmaq** – fayda götürmək, xeyir görmək, faydalanmaq. *..Biz vaporun, teleqrafın, təbabətin nemətlərindən nəfbərdar oluruq.* C.Məmmədquluzadə. [İmran Gülzara:] [Atanın] *fikri odur ki, səni*

*bir dövlətli adama verə ki, ondan nəfbərdar ola.* S.S.Axundov.

**NƏFƏR** *is.* [*ər.*] 1. Bir tək adam; kimsə, şəxs, fərd, kəs. *..Tək bircə nəfərin də fikrinə gəlmir ki, dünyada yaşamaq ibarət deyil ondan ki, səhər dükana gedib, axşam abgüştü yeyib yatasan*. C.Məmmədquluzadə. [Sultan bəy:] *Hə, indi nə deyirsən, bir nəfər molla, bir kəllə qənd və üç manat pul ilə aran necədir?* Ü.Hacıbəyov. // Adam haqqında saylarla. *Üç nəfər gəldi. On nəfər növbə gözləyirdi. – Faytondan iki nəfər yapıncılı adam düşdü*. M.Hüseyn. **Bir nəfər** *əvəz.* – kim isə, birisi, qeyri-müəyyən şəxs, adam. *Bir nəfər gəlib sizi soruşurdu.* – [Nökər:] *Vəzir sağ olsun, bir nəfər Şirazdan gəlib sizi görmək istəyir*. Ü.Hacıbəyov. *Təpə arasında .. tonqal yanırdı. Kənarında bir nəfər yatmışdı...* Çəmənzəminli. **Bir nəfərə (nəfərinə) qədər (kimi)** – hamısını, başdan-başa, elliklə. **Milis nəfəri** – *köhn.* milisioner. *Milis nəfərləri maşından düşüb şinellərini soyundular və təklif gözləmədən dəhrə, yaba götürüb kol qırmağa başladılar*. Ə.Vəliyev. **Polis nəfəri** – polis idarəsi işçisi. *Ucaboy və namərbud hərəkətli bir polis nəfəri içəri girdi.* İ.Şıxlı.

2. Adi əsgər, adi sıravi döyüşçü. *Özünü bu şəhərin oğlu və bu mübarizənin nəfərlərindən sayan Nəriman, ürəyində xoş və parlaq bir hissin işıq kimi yandığını duydu*. Mir Cəlal.

...**nəfərlik** – adətən saylara qoşularaq şeyin neçə nəfərə, neçə şəxsə məxsus, ya aid olduğunu göstərir, məsələn: *üç nəfərlik yer tutmaq. Otuz nəfərlik süfrə hazırlamaq. – Veysin atası Həbib Abdullaoğlu bu daxmada beş nəfərlik bir ailə qoyaraq vəfat etmişdi*. Ə.Əbülhəsən.

**NƏFƏS** *is.* [*ər.*] 1. Ciyərlə havanı içəri alıb buraxma (insan və heyvanlarda oksigen udub karbon qazı buraxma prosesi). *Nəfəs üzvləri. Dərindən nəfəs almaq*. // Ciyərlə alınıb buraxılan hava. [Müəllim və Tellinin] *başları bir-birinə çox yaxın olduğu üçün hər ikisi bir-birinin nəfəsindən gələn sıcaqlığı hiss edirdi.* S.Hüseyn. *Əmirxanı oyatmayır, dincəlsin deyə; Bəzən onun nəfəsinə qulaq da asır.* S.Vurğun. // *məc.* Əlamət, iz, qoxu, təzahür. *Yazın ilk nəfəsi eşidilməyə başladığı bir gündə o, bütün bədəninin od kimi yandığını hiss etdi.* M.İbrahimov. *Yol onu dik qalxan bir yoxuşa gətirib çıxararkən yolçu üzündə, yaxınlığı hiss olunan dağların soyuq nəfəsini duydu.* Ə.Məmmədxanlı. ☐ **Nəfəs(ini) dərmək** – müvəqqəti rahatlanmaq, dincəlmək üçün dayanmaq, azacıq istirahət etmək, yorğunluğunu almaq. [Muzdur] *axır bir nəfəsini dərib pulun hesabına getməyə başladı*. S.M.Qənizadə. *Bir hovur oturub nəfəs dərməyə bir daş kölgəsi də yox idi*. Mir Cəlal. **Nəfəsi qaralmaq (daralmaq, darıxmaq, tutulmaq)** – boğulmaq, çətinliklə nəfəs almaq, tövşümək, təngnəfəs olmaq. [Yasavul:] *Başınıza dönüm, ay ağa, ağzımı elə bağlasınlar ki, nəfəsim darıxmasın.* N.Vəzirov. *Xalidənin halına qalmaq lazım idi, nəfəsi qaralmış idi*. S.Hüseyn. **Nəfəsini qısmaq (gizləmək)** – susmaq, sükut etmək, dinməmək. [Cavahir xatunun] *hər bir kəlməsini yaxşı eşitmək üçün hamı nəfəsini qısıb dinlədi.* M.Hüseyn.

2. *məc. köhn.* "Söz", "dil" mənasında. *Heç doğru deyil bunun nəfəsi; Nə qəzetdir, tamam pul tələsi*. S.Ə.Şirvani. *Süleyman bəy keçmiş günlərdən – Tiflis, Kislovodsk, Vladiqafqaz, Moskva səyahətlərindən qızğın bir nəfəs ilə laf vurmaqda idi.* Ə.Haqverdiyev.

3. "Səs" mənasında. *Xanəndənin nəfəsi dinləyiciləri valeh etdi*.

◊ **Nəfəs almaq (çəkmək)** – 1) dincəlmək, istirahət etmək. [Qəhrəman:] *Bizimkilər irəliləyəndə mən yoldaşlarım ilə bir az asudə nəfəs alırdıq*. H.Nəzərli; 2) rahatlanmaq, sakitləşmək, əziyyətdən qurtarmaq, iztirab və gərginlikdən qurtarmaq. *Hamının qəlbindən xof-xətər getdi və hamı* [Məhəmməd Qacarın] *qətlindən sonra asudə və arxayın nəfəs aldılar*. F.Köçərli. *Gənc ailə asudə nəfəs alaraq xoşbəxt yaşayışına yenidən davam etməyə başladı.* Çəmənzəminli. **Nəfəs vermək** – ruhlandırmaq, həvəsləndirmək, ruh vermək. *Ətrafdan baxan hər bir kəs sanki Fərhadoğlunun ürək döyüntüsünü eşidib ona cürət və nəfəs verirdi.* S.Rəhimov. **Nəfəs vurmaq** *din.* – uğursuz söz demək, göz vurmaq, nifrin tökmək, qarğımaq. **Nəfəsdən düşmək** – əldən düşmək, üzülmək, taqətdən düşmək, incimək, əziyyət çəkmək. [İsrafil:] *Ay arvad, altıma bir şey sal, nəfəsdən düşmüşəm.* Ə.Haqverdiyev. **Nəfəsi kəsilmək** – 1) əldən

düşmək, taqətdən düşmək, üzülmək; 2) *məc.* ölmək. *Qızın gözləri çoxdan axmış, nəfəsi kəsilmişdi.* Mir Cəlal. **Nəfəsini kəsmək** – 1) əldən salmaq, taqətdən salmaq, üzmək. *Bu iş nəfəsimi kəsdi*; 2) öldürmək. [Mirzə Heydər:] *..Tez buyur yazım, bəlkə Hacı oyandı elədi, mənim nəfəsimi kəsər.* Ə.Haqverdiyev. *Qatilləri onun nəfəsini kəsmək istəyirdilər*. S.Hüseyn. **Bir nəfəs** – bir an, bir dəqiqə, bir saniyə. *İstəriz azad olaq zindani-qəmdən bir nəfəs*. M.Hadi. **Son nəfəsdə** – can üstə, ölərkən. **Son nəfəsə qədər (kimi)** – həyatının axırına kimi, ölənə kimi, ölənəcən. *..Qız yaxşı adama rast gələrsə, son nəfəsinə qədər sədaqət və məhəbbət saçaraq yaşayacaqdı.* M.İbrahimov. *..Həyat özü darülfünundur, insan son nəfəsinə qədər öyrənməlidir.* Ə.Sadıq.

**NƏFƏSALMA** *is.* Ciyərlə havanın içəri alınması. *Nəfəsalma prosesi*.

**NƏFƏSLİ** *sif. mus*. Nəfəslə çalınan. *Nəfəsli musiqi alətləri* (ney, klarnet və s.). *Dəniz sahilində nəfəsli hərbi orkestrin çaldığı adı şairanə valsın sədaları gah səmtini tez-tez dəyişdirən xəfif və sərsəri bir küləyin qanadına ilişərək gəlirdi.* Ə.Məmmədxanlı.

**NƏFƏSLİK** *is.* Otağın havasını dəyişdirmək üçün pəncərədə kiçik göz. *Pəncərənin nəfəsliyini açmaq*. // *məh*. Kiçik pəncərə.

**NƏFƏS-NƏFƏSƏ** *zərf* Çox yaxın, lap yaxın, üz-üzə. *Nəfəs-nəfəsə oturmaq. – Hey çalırlar, oxuyurlar nəfəs-nəfəsə; Mənsə baxıb ürəyimdə həsəd çəkirəm.* S.Vurğun.

**NƏFƏSSİZ** *sif.* və *zərf* 1. Haldan düşmüş, cansız. *Nəfəssiz düşüb qaldı. – Dinlədilər yolu bir az nəfəssiz; Qaldılar bir qədər səmirsiz, səssiz.* H.K.Sanılı. *Mən bu lövhələri xəstə, nəfəssiz; Seyr edərək həmən, yüyürdüm səssiz*. S.Vurğun.

2. *məc.* Adamsız, insansız. *Demək, Ağbulaq meşəsi heç də nəfəssiz deyildi*. S.Rəhimov.

**NƏFƏSVERMƏ** *is.* Ciyərdən havanın buraxılması. *Nəfəsvermə prosesi*.

**NƏFİR** *is.* [*ər.*] 1. Ucu getdikcə genişlənən boru şəklində olan nəfəsli çalğı aləti; şeypur. [Dərviş Məstəli şah:] *Mən bu saat elə burada, bu otağın içində bir dairə çəkib əyləşərəm o dairədə, başlaram şah nəfiri çalmağa. Onda görərsən ki, necə sənin evin tarmar olub başına uçar.* Ə.Haqverdiyev.

2. *köhn. məc.* Xəbər yayma, şayiə buraxma.

**NƏFİS** *is.* [*ər.*] Son dərəcə zərif, incə, gözəl, qəşəng. *Nəfis sırğa. Nəfis parça. Nəfis şəkil. – Xalça Fərqanədə toxunmuş, olduqca zərif və nəfis ipəkdən idi.* M.S.Ordubadi. [Mənsur və Sitarə] *təmiz və nəfis ağ paltar geyib bağı seyr edirdilər.* C.Cabbarlı. *..Faytondan ucaboylu, nəfis bir xanım düşüb mağazaya girdi*. Çəmənzəminli. ☐ **Nəfis ədəbiyyat** *köhn*. – bədii ədəbiyyat. *Özünü ziyalı sayan hər bir adam nəfis ədəbiyyatı bilməlidir*. M.Hüseyn. **Nəfis sənətlər** *köhn*. – incəsənət.

**NƏFİSLİK** *is.* İncəlik, zəriflik, qəşənglik.

**NƏFLİ** *sif.* Xeyirli, faydalı. *Əgər bizim xahişimiz qəzetəmizi nəfli və ləyaqətli etmək isə, onda borcumuz budur ki, onun ehtiyacatını düzəldək.* F.Köçərli. *Rəhim kişi hərçənd özü oxumuş adam deyil idisə də, lakin yenə elmin insana nəfli və fərz olduğunu yaxşıca bilir idi.* İ.Musabəyov.

**NƏFS** *is.* [*ər.*] 1. Ehtiras, şiddətli istək, arzu, meyil. *..Mənim belə yadıma gəlir ki,* [türk padşahlarının] *arzu və məşğələləri övrətbazlıq, millətin səadətini öz nəfslərinə qurban eləmək idi*. C.Məmmədquluzadə. *Onda Mahmudun ağlı və ixtiyarı oyanardı, korgözlü nəfsin arxasınca getməzdi.* Çəmənzəminli.

2. Tamah, tamahkarlıq.

3. Tamah, daxili ehtiyac, arzu (adətən mənfi mənada). ☐ **Nəfsini öldürmək** – istədiyini eləməmək, tamahını kəsmək. [Həmzə:] *Bu .. qutulardan bir-ikicəsini verib, onun hələlik nəfsini öldürə bilərik*. Ə.Əbülhəsən.

4. İnsanda şəhvani hisslərə və yeyib-içmək kimi ehtiyaclara olan meyil. *Nəfsini saxlamaq. Nəfsinə məğlub olmaq*. *– Molla qazı Teymur üçün aparanda nəfsini saxlaya bilməyib, bir budunu özü yeyir*. “M.N.lətif.”

5. *köhn.* “Adam”, “insan” mənasında. [Abbas bəy:] *Qoy bir nəfs ölsün, bəlkə neçə min nəfs dirilə!* Ə.Haqverdiyev.

◊ **Nəfsi iti** – 1) son dərəcə tamahkar. [Atlılar] *Əlyar xanın xasiyyətinə bələd idilər, xan nəfsi iti bir adam kimi bütün mahalda məşhur idi.* Ə.Məmmədxanlı; 2) ehtiraslı.

**NƏFSANİ** *sif.* [*ər.*] Ehtirasa, şəhvəti hisslərə aid olan. [Şeyx Sənan:] *Mənə biganə zövqi-nəfsani; Sevdiyim yalnız eşqi-ruhani.* H.Cavid.

**NƏFSKAR** *sif.* [*ər.* nəfs və *fars.* ...kar] 1. Şəhvət düşkünü.

2. Tamahkar, nəfsini saxlaya bilməyən. *Əziz bir az acıqlandı: – ..Sənin kimi nəfskar, dünyanı dördəlli tutan bir adamı briqadir saxlamaq olmaz.* Ə.Vəliyev.

**NƏFSLİ** *sif.* 1. Çox tamahkar, hər şeydə gözü olan.

2. Ehtiraslı, qızğın.

**NƏFSPƏRƏST** *sif.* [*ər.* nəfs və *fars.* ...pərəst] 1. Öz nəfsini güdən, çox tamahkar, hər şeyi öz nəfsinə qurban edən. *Nə vaxta qədər biz biçarələr bu kimi nəfspərəst qərəz sahiblərinin əlində oyuncaq olacağıq?!* M.F.Axundzadə.

2. Şəhvət düşkünü, şəhvətpərəst.

**NƏĞMƏ** [*ər.*] bax **mahnı**. *Çün bülbüli-aşiqi-xoşavaz; Eylərdi çəməndə nəğmə ağaz.* Xətayi. *Can verəndə oxuyun nəğməni Quran əvəzi.* S.Ə.Şirvani.

**NƏĞMƏKAR** *is.* [*ər.* nəğmə və *fars.* ...kar] 1. Nəğmə oxuyan; xanəndə. *O məchul nəğməkar odunçu oğlu Valeh imiş.* Ə.Məmmədxanlı. *Susub durdu bülbül yenə; Həsrət qaldı bu dar qəfəs; Nəğməkarın nəğməsinə.* B.Vahabzadə.

2. Nəğmə qoşan. *Nəğmələr içində mənim nəğməmin ayrı bir yeri var; Mən toxunulmaz hüququmun nəğməkarıyam.* M.Müşfiq.

**NƏH** [*fars.*]: **nəh demək (danışmaq)** – bəd danışmaq, pis gətirmək. *Əziziyəm, nəh demə; Nəh danışma, nəh demə; Qoy öpüm al yanaqdan; Mən də çatım əhdimə.* (Bayatı).

**NƏHAYƏT** [*ər.*] 1. *is.* Son, axır, qurtaracaq. *Hər şeydə başlanğıc və nəhayət vardır. Bu işin nəhayəti nə olacaq? – Həyat nəşəsilə titrəyir içim; Parlaq gələcəyim, nəhayətim var.* M.Müşfiq. ◻ **Nəhayət vermək (qoymaq)** – saxlamaq, dayandırmaq, son vermək. *Geriliyə nəhayət vermək. İşə nəhayət vermək. – ..*[Səlimə] *yalnız tərəddüdlərinə bir nəhayət verdi.* S.Hüseyn. **Nəhayətə yetmək** – sona çatmaq, axıra yetmək, qurtarmaq. *Zülfi-ruxun hekayəti yetməz nəhayətə; Gər etsələr səfidü-siyəh sübhü-şam bəhs.* S.Ə.Şirvani. **Nəhayəti yetmək** – axırı çatmaq, axırı olmaq, ölümü çatmaq. [Mənsur:] *Hicrində yandım, ey mələk, dəxi yetdi nəhayətim.* C.Cabbarlı.

2. *is.* Qurtaracaq, uc. *Məftilin nəhayətini bir nöqtədə birləşdirmək.*

3. *zərf* Axırda, sonda, nəticədə. *Nəhayət gəldi çıxdı. Nəhayət başa düşdü.* – [Rzaqulu-xanın] *Parisin teatr və sair ədəbiyyat səhnələrində oxuduğu leksiyalar və müasir xitabələr ağızdan-ağıza dolaşaraq, nəhayət qəzetlərdə və jurnallarda dərc olunardı.* M.S.Ordubadi. *Bəhramı bir ceyran yamanca yordu; Nəhayət bir keçid başında vurdu.* A.Şaiq. // *Ara söz mənasında.* Bir də, bunlardan əlavə, hər şeydən sonra. *İstirahət üçün, nəhayət, şəhərdən kənara çıxmaq olardı.*

4. *zərf* Həddindən artıq, son dərəcə, olduqca. *Ey mənim əziz qardaşlarım! Məktubunuzu açıb oxudum, nəhayət hər ikinizdən razıyam.* C.Məmmədquluzadə. *Biçarə qolunun ağrısından bitab düşüb, nəhayət məşəqqətlə özünü sınıqçı Kərbəlayı Piriyə yetirdi.* S.M.Qənizadə. // **Nəhayətdə** şəklində həmin mənalarda. *Nəhayətdə sevindi. – ..Keçən il nəhayətdə quraqlıq olmaq səbəbilə və Qəzvinin ətrafında suyun qıtlıq cəhətilə əksəri-məhsulat yanıb əmələ gəlməmişdi.* M.F.Axundzadə. *Ömər nəhayətdə ağıllı və kamallı oğlandır, amma bunun ilə belə atasının xoşuna gəlmir.* N.Nərimanov. ◻ **Nəhayət dərəcədə** – son dərəcə, çox, artıq, hədsiz dərəcədə. *..Məcmuəmizin açılması barəsində .. teleqram və məktub göndərənlərdən nəhayət dərəcədə məmnun olub, bizi yada salanlara izhari-təşəkkür edirik.* "Mol.Nəsr.". [Kəndin] *əhalisi isə nəhayət dərəcədə avam, həkimsiz, dərmansız yaşayırdılar.* S.S.Axundov. *Vəhşi ilə Qaraçı kənddə böyüyüb nəhayət dərəcədə dost olurlar.* H.Sarabski.

5. **Nəhayətində** şəklində – sonunda, axırında, qurtaracağında. [Məsmə:] *..Həftə nəhayətində onu yoxlamağa getdim.* S.Hüseyn. *Küçənin nəhayətindəki fənər yandı.* Ə.Məmmədxanlı.

6. *ara söz.* Çoxdan gözlənilən bir işin başa gəldiyini, axırda müsbət nəticələndiyini və bundan duyulan məmnunluğu ifadə edir. *Nəhayət, qız gəlib çıxdı. Nəhayət, maşın yola düşdü. Nəhayət, yay tətili yetişdi. – Nəhayət, komissiya üzvlərinin hamısı bir rəyə gəldi: "Ceyran düzü perspektivdən məhrumdur".* M.Hüseyn. *Nəhayət, həsrətlə görmək istə-*

*diyimiz bu tarixi şəhərə qədəm qoyuruq.* M.İbrahimov.

**NƏHAYƏTSİZ** *sif.* və *zərf* Sonsuz, bitməz, tükənməz, sonu-axırı, hədd-hüdudu olmayan. *Nəhayətsiz dalğalar bir-birini qovurdu. Nəhayətsiz üfüq. Nəhayətsiz adam axını. – Novruzun hədəqədən çıxmış gözləri hənuz nəhayətsiz fəzalara dikilmişdi.* H.Nəzərli. *Doğrudan da Mərcan nənənin qəzəbi nəhayətsiz idi*. Mir Cəlal.

**NƏHAYƏTSİZLİK** *is.* Sonsuzluq, intəhasızlıq, axırı, sonu olmama. [Ceyranlar] *incə qulaqlarını qısıb dalbadal havaya atlandıqca düzənliyin nəhayətsizliyi fonunda qəribə mənzərə yaranırdı.* İ.Əfəndiyev.

**NƏHƏNG** *sif.* [*ər.*] Son dərəcə böyük, iri, çox yekə, azman. *Nəhəng bina. Nəhəng adam. Nəhəng qala. – Buğlana-buğlana nəhəng maşınlar; Qar təpələrinə hücum çəkdi, bax!* S.Vurğun. *Bu işıqlar tapdanıb söndürülən nəhəng bir tonqalın közərən qığılcımlarına bənzəyir.* M.Rzaquluzadə. // Məc. mənada. *Nəhəng sənətkar. – ..Xalq isə bütün gələcək tarixin heyrət edəcəyi nəhəng çətinliklərdən şərəflə çıxdı.* Ə.Məmmədxanlı.

**NƏHƏNGLİK** *is.* Həddindən artıq böyüklük; yekəlik, irilik, azmanlıq.

**NƏHR** *is.* [*ər.*] Böyük çay, axar su. *Heç maraq etmə, yaxınlarda səni; Yenə Kür nəhri öpər*. H.Cavid. *Tərlan keçən ilin yazında olduğu kimi indi də Kür nəhrinin qudurğan bir sürətlə daşacağını heç gözləmirdi.* M.Hüseyn.

**NƏHS** [*ər.*] 1. *sif.* Uğursuz, məşum, ağır, tərs gətirən. *Nəhs ay. Nəhs ayaq. – Elə ki, nəhs günlərə keçdim və istədim bu bəndi də oxuyam, qırmızısaqqal rəfiqim məni bu yerdə dayandırdı*. C.Məmmədquluzadə. [Vaqif Əliməmmədə:] *Novruz səhəri güldanım düşüb sındı. Bu, nəhs bir şey deyilmi?* Çəmənzəminli. *Ataş Mürsəli kəndə göndərmək fikrinə düşən günlərdə Qarabağın nəhs ilinin uğursuz ayı idi.* Ə.Vəliyev. □ **Nəhs demək (gətirmək)** – bəd danışmaq, ağzını bədə açmaq. *Aşıq sözün nəhs dedi; Gəl dilimi kəs, dedi; Mən dedim, bir busə ver; O məndən can istədi.* (Bayatı). [Paşa:] *Sən niyə nəhs gətirdin, arvad?* S.Rəhimov.

2. *is.* Tərs, gəc, inad. *Nəhs adam*.

**NƏHSLİK** *is.* Uğursuzluq, məşumluq, pislik, bədlik. *Kim isə bütün bu işləri bu yerin adının nəhsliyinə yozur..* Ə.Sadıq.

**NƏHV** [*ər.*] b a x **sintaksis**.

**NƏHVİ** [*ər.*] b a x **sintaktik**. *Aman, ay Molla, bu şeri oxu, mənasına bax! Sərfinə, nəhvinə, imlasına, inşasına bax!* Ə.Vahid.

**NƏHY** *is.* [*ər.*] 1. Qadağan, qadağan etmə. *Zahid şərab nəhyi üçün ayə söyləyir; Lakin sorulsa, anlamayır hansı ayədir.* Ə.Vahid.

**NƏXŞ** b a x **naxış**.

**NƏİNKİ** Mənaca güzəşt bildirən mürəkkəb bağlayıcı. *Vəliqulu nəinki anasına nisbət, bəlkə özgələrə görə də artıq üzüyola oğlandı.* C.Məmmədquluzadə.

**NƏKARƏ** *dan.* "Kimdir?", "Nəçidir?", "Nə cürətin sahibidir?", "Ağzı nədir?" mənalarında sual əvəzliyi məqamında işlənir. *O nəkarədir bu sözü desin?* – [Heydər bəy:] *Özü sövdəgər, tacir kişidir, ta mənim kimi adama yanaşmasa, nəkarədir ki, Arazın o tayına ayaq basa bilə?* M.F.Axundzadə. [Nurcahan:] *..Ağzı nədir, nəkarədir mənə güldən ağır söz deyə bilsin.* N.Vəzirov. [Bir ayrısı:] *Xan, başına dönüm, mən nəkarəyəm ki, sənnən güləşəm?* Çəmənzəminli.

**NƏQAHƏT** *is.* [*ər.*] Xəstəlikdən təzə qalxıb özündə əzginlik hiss edən, hələ tamamilə sağalmamış adamın halı; zəiflik, süstlük, əzginlik, nasazlıq. [Əliqulu:] *Ancaq ərbabın bir balaca nəqahəti var*. S.S.Axundov.

**NƏQƏRAT** *is.* [*ər.*] *mus*. Nəğmənin hər bəndindən sonra təkrarlanan beyt və misralar. *Kupletlər bir-birindən nəqərat vasitəsilə ayrılır.* Ə.Bədəlbəyli.

**NƏQL** *is.* [*ər.*] 1. b a x **nağıl**. *Qəhrəman balaca Sabir üçün müxtəlif nəql danışırdı*. S.Rəhimov. □ **Nəql etmək** – bir əhvalatı, hadisəni, hekayəni və s. ardıcıllıqla danışmaq, söyləmək. *O qədər çox ki, böyük işlərimiz; Onu nəql etməyə şerim aciz.* M.Müşfiq.

2. *köhn.* Bir yerdən başqa yerə aparma, köçürmə, daşıma. □ **Nəql etmək** – bir yerdən başqa yerə aparmaq, köçürmək, daşımaq. *Başlarda bəlanı çox görüb əql; Bir özgə məqamə eylədi nəql*. Füzuli. [Səkinə xanım:] *Mən öləndən sonra məni qəbiristana nəql edin*. M.F.Axundzadə.

3. *xüs*. Cərəyan, səs və s. keçirən; keçirici. □ **Nəql etmək** – keçirmək, ötürmək. *Mis elektriki yaxşı nəql edir*.

**NƏQLİ** [*ər.*]: **nəqli cüml**ə *qram*. – müəyyən bir hadisə, əşya, əlamət və s. haqqında məlumat verilən cümlə növü.

**NƏQLİYYAT** *is.* [*ər.* "nəql" söz. cəmi] 1. Xalq təsərrüfatının, adamların və yüklərin daşınması ilə əlaqədar olan sahəsi, habelə bu və ya başqa daşıma vasitələrinin hər hansı bir növü. *Avtomobil nəqliyyatı. Dəmiryol nəqliyyatı. Yeraltı nəqliyyat* (metropoliten). *Şəhər nəqliyyatı* (tramvay, avtobus, trolleybus, taksi).

2. Yüklərin (sərnişinlərin) bir yerdən başqa yerə daşınması, aparılması, nəql edilməsi; daşıma işləri. *Yüklərin nəqliyyatını gecikdirməməli.*

3. Xüsusi vəzifəli daşıma vasitəsi. *Sanitar nəqliyyatı*.

**NƏQLİYYATÇI** *is.* Nəqliyyat işçisi. *Nəqliyyatçılar .. motovozları vaxtından qabaq təmir edib işə salmışlar*. (Qəzetlərdən).

**NƏQŞ** [*ər.*] *klas.* bax **naxış**. *O, gözünü bir nöqtəyə, oturduğu xalçanın nəqşinə zilləmişdi*. M.S.Ordubadi. *Xalının rəngi, çeşnisi, nəqşi tərifəlayiq idi.* Ə.Vəliyev.

**NƏQŞƏ** [*fars.*] bax **plan** 1 və 3-cü mənalarda. [Məsmə:] *İndi öz otağıma daşındıqda, ta qızlığımdan xəyalımda nəqşəsini çəkdiyim otağı hazırlamağa başladım.* S.Hüseyn. *Nagəhani qərarla pozur bütün nəqşəni; Bir hərəkətlə yarır rəqibinin səddini*. R.Rza.

**NƏQŞLİ** bax **naxışlı** 1-ci mənada. *Belində zərif nəqşli tirmə .. var idi*. M.Rzaquluzadə. [Aslan:] [Anamın] *toxuduğu nəqşli ərəqçinlər hamını valeh edirdi*. S.Vəliyev.

**NƏLBƏKİ** *is.* Stəkan, fincan altına qoyulan müxtəlif ölçülü çini və ya şüşə qab. *Dilşad xanım çayı nəlbəki ilə içər.* T.Ş.Simurq. *Sona .. öz çayını nəlbəkiyə töləndə Qədirə işarə ilə rişxəndyana dedi..* Ə.Əbülhəsən. □ **Nəlbəki boyda (böyüklüyündə)** – nəlbəkiyə oxşayan, nəlbəki kimi. *Nəlbəki boyda gül. Nəlbəki boyda ay-ulduz*. – [Kərbəlayı Məmmədəli:] *..Oradan, buyur, mənə bir medal gəlsin nəlbəki böyüklüyündə*. N.Vəzirov. *Qızılgül kolunun üstündə nəlbəki boyda iri güllər açılmışdı.* İ.Əfəndiyev.

**NƏLEYİN** *is.* [*ər.*] *köhn.* Başmağa oxşar ayaqqabı. [Molla Qasım] *ayağına qara meşindən dikdaban Təbriz dübəndisi və bəzi vaxt sarı rəngli nəleyin geyərdi.* H.Sarabski. *Ayaqlarındakı nəleyinləri sürükləyən bu qadınlar ağır-ağır yeriyirdilər.* Ə.Məmmədxanlı. // Hamamda və s. nəm yerlərdə geyilən altı taxta ayaqqabı.

**NƏM** *is.* 1. Yaşlıq, islaqlıq, rütubət. *Nəm çəkmək. Nəmini almaq.* // *sif.* Azca yaş, islaq, rütubətli. *Nəm torpaq*. *Nəm divar. Nəm paltar.* // Rütubət. *İnsanı qəm çürüdər; Dəmiri nəm çürüdər*. (Məsəl). *Gəldiyev əlindəki kibrit çöpünü nəm çəkmiş zərflərin böyründən salır, bura-bura açırdı.* Mir Cəlal.

2. *məc.* "Yaş (göz yaşı)" mənasında. *Göz neçin ağlayıb tökməsin nəmi; Heyvan ha deyil ki, çəkməyə qəmi*. M.V.Vidadi. *Ağlın olsun, sil gözünün nəmini; Dəxi geri gəlməz onlar, ağlarsan!* M.P.Vaqif. *Seyyid, əgər ol şəmə sənin yanmadı könlün; Pəs pərdeyi-çeşmində olan nəm nə üçündür?* S.Ə.Şirvani.

◊ **Nəm çəkmək** – 1) rütubətdən islaq hala gəlmək, islanmaq, canına rütubət çəkmək; 2) *məc.* xarab olmaq, korlanmaq, qalıb köhnəlmək.

**NƏMÇİLƏMƏ** "Nəmçiləmək"dən *f.is.*

**NƏMÇİLƏMƏK** *f.* Narın-narın yağmaq, yağış çiləmək. *Yavaş-yavaş yağış nəmçiləyir, xırda damcılar Gülzarın üzünə, döşlərinə toxunurdu.* C.Cabbarlı.

**NƏMÇİMƏ** "Nəmçimək"dən *f.is.*

**NƏMÇİMƏK** *f.* 1. Nəm çəkmək, yaş olmaq, nəm olmaq. *İndi bildim ki, qocalmışam. Yoxsa mən olam, iş görəndə alnım nəmçiyə.* Ə.Vəliyev.

2. Yaşarmaq, doluxsunmaq, sulanmaq. *Pası nəmçimiş* (f.sif.) *gözlərini silə-silə: – Ya bizi, ya da .. qohumunu!. – dedi.* S.Rəhimov. *Atamın cəbhəyə getdiyi günü xəyalıma gətirib kövrəldim, gözlərim nəmçidi*. Ə.Vəliyev.

**NƏMƏKBƏHARAM** *sif.* və *is.* [*fars.* nəmək bə... və *ər.* həram] Yaxşılığı itirən, nankor, duz-çörək itirən (çox vaxt söyüş mənasında). [Xan:] *İkinizi də burada parça-parça eləyəcəyəm. Nacinslər, nəməkbəharamlar!* Ə.Haqverdiyev. [Hacı Nəsir:] *Ay nəməkbəharam, mən sənin kimi bir kasıb qızını dilənçilikdən qurtarıb özümə arvad etdim*. S.S.Axundov.

**NƏMƏKDAN** *is.* [*fars.*] Duzqabı. *Süfrəyə nəməkdan qoymaq. – Dedim ki, nankorsan, duz-çörək yedin; Həyat süfrəsində sındı nəməkdan.* Şəhriyar.

**NƏMƏKİ** *sif.* [*fars.*] Təbiətcə şux, məzəli, duzlu. *O çox nəməki adamdır.* – [Mirzə Ələkbər Sabir] *nəməki danışmağı, şux, zərif və hazırcavablığı səbəbindən az zamanda üləma və əyanın yanında məruf və məşhur olur və ümumun məhəbbətini cəlb edir.* A.Səhhət.

**NƏMƏKOV** *is.* [*fars.*] Xarab olmamaqdan ötrü yağı, pendiri və s. qoymaq üçün hazırlanan duzlu su.

**NƏMƏNƏ** *dan. köhn.* "Nə?", "necə?" mənalarında sual əvəzliyi. [Molla Səfi:] *Ay Cəbi, bu qutudakı nəmənədir?* N.Vəzirov. [Xortdan:] *Mərdəki, burada nəmənə qayırırsan?* Ə.Haqverdiyev. [Qafar arvadına:] *Nəmənə? Səni teatra aparım?* S.S.Axundov.

**NƏMƏR** *is. etnoqr.* Xalq adətincə toyda, nişanda paylanan şirni, pul və s. [Toyda] *o qədər xələt, o qədər nəmər yığıldı ki, hədsiz-hesabsız.* "Koroğlu". *Xanım nəmər bağışladı; Ələsgər yazdı dəftərə.* Aşıq Ələsgər.

**NƏMİ** *is. məh.* Alaçığın içəri-sində qarğıdan hörülmüş bağlı yer; anbar. [Güldəstə:] *Atam karıxdığından nəminin qapısını açıq qoyub gedibdir.* Ə.Haqverdiyev. *Qəhrəman alaçıqdakı nəmidə gizləndi.* Ə.Vəliyev.

**NƏMİŞ** *sif.* Rütubətli, yaş, nəm. *Nəmiş külək.* – [Odunçuoğlu] *arxası üstə nəmiş torpaq döşəmə üstündə uzanmışdı.* Ə.Məmmədxanlı. *Nəmiş hava dərdli ana kimi ağlayır, göz yaşını quruda bilmirdi.* Ə.Vəliyev.

**NƏMİŞLƏNMƏ** "Nəmişlənmək"dən *f.is.*

**NƏMİŞLƏNMƏK** b a x **nəmlənmək**.

**NƏMİŞLİK** *is.* 1. Yağmurluluq, yağışlılıq, yağıntı. *Yaz nəmişlik* (z.) *keçdi.* – [Babakişi:] *Bu il, qızım, türkün sözü, nəmişlik olmadı, havalar quru keçdi, mən də borca düşmüşəm.* C.Cabbarlı. [Ana:] *Keçən il nəmişlik, bu il də quraqlıq.* Ə.Vəliyev.

2. Nəm, yaş, rütubətli. *Yer nəmişlik idi. Gecənin ayazı adamın iliyinə işləyirdi.* M.Hüseyn.

**NƏMLƏNDİRMƏ** "Nəmləndirmək"dən *f.is.*

**NƏMLƏNDİRMƏK** *f.* Nəm etmək, rütubətləndirmək.

**NƏMLƏNMƏ** "Nəmlənmək"dən *f.is.*

**NƏMLƏNMƏK** *f.* Nəm olmaq, canına su çəkmək; rütubətlənmək. *Torpaq yağışdan sonra nəmlənib.*

**NƏMLƏŞMƏ** "Nəmləşmək"dən *f.is.*

**NƏMLƏŞMƏK** *f.* Nəm olmaq, rütubətlənmək, yaş olmaq.

**NƏMLİ** *sif.* 1. B a x **nəm** 1-ci mənada. *Nəmli torpaq. Nəmli divar.* – [Vaqif:] *Gözümün işığı, canım, ciyərim; Bu nəmli torpaqlar olsa da yerim.* S.Vurğun. [Firudin] *nəmli kərpicin üstündə oturduqda hərəkət edib gedən maşının səsini eşitdi.* M.İbrahimov.

2. *məc.* Yaşarmış, doluxsunmuş, yaşla dolmuş. *Nəmli kirpiklər. – Görünür o nəmli gözlərin mənə; Kirpikləri şehli qərənfil kimi.* S.Rüstəm. *Könül qəmli, gözlər nəmli; Başaşağı gedir hamı.* B.Vahabzadə.

**NƏMLİK** *is.* Yaşlıq, rütubətlik, rütubət. *Havanın nəmliyi. Küləyin nəmliyi. – Qar az yağdığından torpağın nəmliyi kifayət deyil.* Ə.Vəliyev.

**NƏMLİLİK** *is.* Nəm şeyin halı. *Torpağın nəmliliyi. Havanın nəmliliyi.*

**NƏM-NÜM**: **nəm-nüm etmək (eləmək)** *dan.* – özünü naza qoy-maq, zahirən narazılıq göstərmək, razı olmamaq. [Pərzad:] *..Bunun qabağında beş min manat başlıq nədir ki, ona* [Hacı Seyidgil] *nəm-nüm edirlər?* Mir Cəlal. [Atam:] [Mirzə Cəmil] *hərgah ədəb-ərkanla* [qızı] *verdi, məsələ qurtardı, nəm-nüm eləsə gecənin birisində qızı götürüb qaçacağam.* Ə.Vəliyev.

**NƏNƏ** *is.* 1. Atanın, yaxud ananın anası; nəvəsi olan qadın. *..İkramın fikri dəyişir, bütün günahları nənəsində görürdü.* Ə.Əbülhəsən.

2. Bəzi yerlərdə anaya deyilir.

3. Yaşlı və hörmətli qadın, yaxud yaşlı qadına hörmətlə müraciət. [Yusif:] *Xoş gəlibsən, Pərzad nənə!* N.Nərimanov. // Çox qoca qadın haqqında. [Qarı:] *Qurban sana qarı nənən; Xeyir xəbər gətirdim mən.* S.Vurğun. // Bəzən xitab yerində işlənir. *Nənə, buyurun, əyləşin.*

**NƏNƏCAN** *is.* Nənəyə, yaxud qoca qadına mehribanlıqla müraciət. *Nənəcan, bir az oturub dincinizi alın.* – [Qumru:] *Köməyə gəl, nənəcan, mən tapa bilmirəm, o* [boyaqgülü] *hansıdır?..* Ə.Məmmədxanlı.

**NƏNƏCİK** b a x **nənəcan**.

**NƏNƏLİK** *is.* 1. Ögey nənə. *Məsmə Səlimin nənəliyi hesab olunurdu*. Mir Cəlal.

2. *məc.* Analıq. [Hacı Murad:] *Durub təzədən ona nənəlik edə bilmərəm ki*. S.S.Axundov.

3. Nənənin nəvələri üzərindəki haqqı. // Nənə ilə nəvəsi arasındakı qan qohumluğu.

**NƏNNİ** *is.* 1. Körpə uşaqları yatırtmaq üçün asılan kiçik yatacaq. [Qumru] *uşağı nənniyə salıb küncə qısıldı*. Mir Cəlal. *Tarlanın ortasında palıd ağacının budaqlarından çoxlu nənni asılmışdı.* İ.Hüseynov.

2. Uzanıb, ya oturub dincəlmək üçün ağaclara, dirəklərə bənd olunmuş asılı tor; qamak.

**NƏR** *sif.* [*fars*] 1. Erkək (dəvə). *Sarbanın yerə yatırdığı nər dəvə onu belinə aldı, sonra nərildəyərək ayağa qalxdı.* Ə.Məmmədxanlı. // İs. mənasında. *Qoyun, quzu, at, eşşək; Salmış çölə qalmaqal; Dəvə, maya, nər, köşək; Lökləyirlər dalbadal.* A.Səhhət. *Haça buğurlar, dizi qara nərlər, gözəl arvanalar .. qoyun sürülərinin dalınca gəlirdilər*. Ə.Vəliyev.

2. *məc.* Qorxmaz, güclü, qüvvətli, cəsarətli. *Qovğa günü öyündüyüm; Nər dəlilər yerindəmi?* "Koroğlu". *Onun səadətini qoruyan nər oğullar; Sizin qollarınızda yeddi aslan gücü var!* N.Rəfibəyli. ☐ **Nər kimi** – qorxmadan, cəsarətlə, igidcəsinə. *Nər kimi meydana atıldı. Nər kimi vuruşmaq. – Mərd olub nər kimi girək meydana; Gücümüzü göstərək bu gün divana*. "Qaçaq Nəbi". *Bir qoçağam, qoç nər kimi yaşaram!* M.Ə.Sabir.

**NƏRD** *is.* [*ər.*] 24 xanası olan iki çərçivəli taxtadan, 30 daşdan və iki zərdən ibarət oyun aləti. // Həmin alətlə oynanılan oyun. *Axşamçağı nərd oynamağa yanıma gəlmiş dostum içəri gircək yenə də köhnə adəti üzrə ikinci mühəndisi tərif eləməyə başladı.* B.Talıblı. *Bir otaqdan nərdin şaqqıltısı eşidilir, o biri otaqda gərgin bir sükut içində şahmat oynanılırdı.* M.Rzaquluzadə. ☐ **Nərd atmaq (vurmaq)** – nərd oynamaq. [Həsrət Yusifə:] *Hə, necəsən, bir əl nərd ataq, ya yuxun gəlir?* B.Bayramov.

**NƏRDİVAN** *is.* [*fars.*] Bir yerə qalxmaq və ya enmək üçün ağacdan, dəmirdən, ipdən və s.-dən düzəldilmiş pilləli vəsait. *Orada evin damına çıxan bir nərdivan var idi*. H.Nəzərli.

**NƏRDTAXTA** b a x **nərd**. [Budaq:] *Mirzə Alış məni Osman bəygildən nərdtaxta gətirməyə göndərdi*. Ə.Vəliyev.

**NƏRƏ¹** *is. zool.* Qiymətli əti, kürüsü olan, çaylarda, dənizlərdə yaşayan qığırdaqlı balıq.

**NƏRƏ²** *is. məh*. Evlərin üstünə qoyulan tir. *Su gəldi, pərə dəydi; Ox keçdi, nərə dəydi; Sənin kimi cavanlar; Tezliklə yerə dəydi.* (Bayatı).

**NƏRƏ³** *is.* [*ər.*] Hücum, həmlə, vuruş əsnasında bərk bağırma; bağırtı. ☐ **Nərə çəkmək, nərə vurmaq** – bərk bağırmaq. *Koroğlu axırda bir dəli nərə çəkib, Dəli Həsəni götürüb yerə vurdu*. "Koroğlu". *Nəbi bir nərə çəkdi ki, dağ-daş titrədi.* "Qaçaq Nəbi". // Ümumiyyətlə bərk qışqırıq; çığırtı. *Muradqulu və Heydərqulunun nərələri evə bir elə vəlvələ saldılar ki, guya elə bu saat dünya və aləm dağılacaq?* C.Məmmədquluzadə. [Rüstəm kişi] *birdən elə nərə çəkib qışqırdı ki, səsinə çöllər titrədi*. M.İbrahimov.

**NƏRGİZ** *is.* [*fars.* əsli *yun.*] Ətirli ağ və ya sarı çiçəkləri olan soğanaqlı gül. *Nərgizi, bənövşəni; Qəddinə heyran elədin!* Aşıq Ələsgər. // *məc.* Bəzən gözəlin gözləri bu gülə oxşadılır. *Oğrun baxa-baxa, ey çeşmi nərgiz; Dərdə saldın məni, xəstəhal etdin.* M.P.Vaqif. *..Ruqiyyə dəli kimi üzümə baxdı. Nərgiz gözləri yaşla dolub halqalandı.* A.Divanbəyoğlu. *Qara qış üstümə tökər qarını; Nərgiz gözlərindən məni ayırsan*. M.Müşfiq.

**NƏRİLDƏMƏ** "Nərildəmək"dən *f.is.*

**NƏRİLDƏMƏK** *f.* 1. Nərilti səsi çıxarmaq; bağırmaq, qışqırmaq, nərə vurmaq. [Pələng] *iki-üç addım məndən aralı bir qaratikan kolu yanında yıxılıb nərildəyirdi.* A.Şaiq. *Xan acığından şəbkülahını başına basıb bir az vəhşi heyvanlar tək nərildədi.* Çəmənzəminli.

2. *məc.* Guruldamaq, uğuldamaq, gurultulu səs salmaq. *Çay nərildəyib meşəyə səs saldı. – Qatar nəhəng bir əjdaha kimi yorğun və boğuq bir səslə nərildəyib getdi.* M.Rzaquluzadə.

**NƏRİLTİ** *is.* 1. Bağırtı, böyürtü, qışqırıq, çığırtı, nərə səsi. ..[Ovçular] *mağaranın içindən ayının nəriltisini eşidib, tüfənglərini hazırladılar və itləri içəri qısqırtdılar.* S.S.Axundov.

2. *məc.* Gurultu, uğultu, dəhşətli səs. *Hamı dənizin heybətli nəriltisini dinləyirdi.* M.Hüseyn. *Haradansa, uzaqlardan şiddətlə qayalara çarpan dəniz dalğalarının qorxunc nəriltisi gəlirdi.* M.Rzaquluzadə.

**NƏRİLTİLİ** *sif.* Gurultulu, uğultulu, son dərəcə səsli-küylü. *Belə bir şaqqıltılı, nəriltili, gurultulu hala adət edib alışmış Fərhadoğlu dərin fikirdən ayrıldı..* S.Rəhimov.

**NƏRMƏ-NAZİK** *sif.* 1. İncə, zərif, nazik. *Ağ biləklərində qızıl bilərzik; Zərif, lətif, sevimli, nərmə-nazik.* A.Səhhət. [Zeynal:] *Mənim belə nərmə-nazik dövlətli xanımlarından xoşum gəlmir..* Ə.Əbülhəsən. *Teymurun qardaşı nərmə-nazik, ağbəniz və qəşəng olduğu üçün Şəmsi ona* "*qız Seymur*" *deyirdi.* H.Seyidbəyli. // *məc.* Ruh oxşayan, ürəyəyatan; incə, zərif. *Külli-Qarabağın abi-həyatı; Nərmə-nazik bayatıdır, bayatı.* M.V.Vidadi. 2. Ağır, çətin, fiziki işlərə adət etməmiş, ümumiyyətlə, fiziki işdən qaçan adam haqqında (yalnız mənfi mənada işlənir).

**NƏRMƏ-NAZİKLİK** *is.* İncəlik, zəriflik, naziklik.

**NƏRTAXTA** b a x **nərdtaxta**. [Koroğlu:] *Qurun nərtaxtanı, gəlin oynayaq; Atın ağ zərləri, şeşi beş olsun.* "Koroğlu". *Oyun otağından nərtaxta səsi gəlirdi.* Ə.Sadıq.

**NƏSB** *is.* [*ər.*]: **nəsb etmək** – rəbt etmək, bağlamaq, bənd etmək.

**NƏSƏ** *dan.* "Nə isə" sözünün ixtisar forması. *Yol gəlir Kəsəməndən; Yar küsüb nəsə məndən; Qorxuram gec qayıdam; Meylini kəsə məndən.* (Bayatı). *Adamlar bu saat nəsə bir şey olacaq gümanı ilə intizar çəkirdilər.* Mir Cəlal.

**NƏSƏB** *is.* [*ər.*] Mənşə, nəsil, soy, əcdad silsiləsi (çox vaxt "əsil-nəsəb, əslü-nəsəb" şəklində işlənir). *Əslü-nəsəbim sənə əyandır; Hökmüm neçə min evə rəvandır.* Füzuli. [Heydər bəy:] *Zatında şübhə olanlar öz nəsəbləri üçün şəhadətnamə qayırarlar.* M.F.Axundzadə.

**NƏSX** *is.* [*ər.*] Əsasən kitab çapında işlədilən ərəb yazı xətlərindən birinin adı.

**NƏSİB** *is.* [*ər.*] Qismət, hissə, pay, bəxtə çıxan şey, bəxt. ☐ **Nəsib etmək (eyləmək)** – qismət etmək, uğruna çıxartmaq. *Yarımı yar eylədin əğyarə, ey fələk; Etdin gülü nəsib genə xarə, ey fələk!* S.Ə.Şirvani. *Çoxdandır ki, sizin şərəfinizə piyalə qaldırmamışam, bu gecə iqbalımız bizə bu səadəti nəsib etmişdir.* M.S.Ordubadi. **Nəsib olmaq** – qismət olmaq, bəxtinə çıxmaq, payına düşmək, çatmaq; müyəssər olmaq. [Pərzad:] ..*Əyər mən vuran-yıxan oğlana nəsib olsaydım, sənə nəsib olardım.* M.F.Axundzadə. [Vəliəhd:] *Görüşə bildim, heç bir kəsə nəsib olmayan bir səadət ancaq mənə nəsib oldu.* M.S.Ordubadi.

**NƏSİHƏT** *is.* [*ər.*] Öyüd, yol göstərici sözlər. *Ata nəsihəti. Nəsihətə qulaq asmaq.* ☐ **Nəsihət vermək (etmək)** – öyüd vermək, ağıl vermək. [Müəllim:] ..*Təvəqqe eləyirəm, Mirzə Cəlala nəsihət eləyəsiniz ki, dərslərinə can yandırsın.* C.Məmmədquluzadə. [Mirzə Cavad:] *Ay oğul, nə olar bu qoca atana elədiyin nəsihətdən bir az da özünə eləyəsən.* Ə.Haqverdiyev.

**NƏSİHƏTAMİZ** *sif.* [*ər.* nəsihət və *fars.* ...amiz] Nəsihətverici, öyüd verən, ağıl öyrədən; nəsihətyana, nəsihətlə dolu; dərin, ağıllı. *Nəsihətamiz atalar sözü. Nəsihətamiz aforizmlər. – Qaraş Mayanın nəsihətamiz şəkil alan sözlərinə dözə bilməyib ayağa durdu.* M.İbrahimov.

**NƏSİHƏTAMİZLİK** *is.* Nəsihət xasiyyəti daşıma, nəsihət mahiyyətində olma.

**NƏSİHƏTÇİ** *is.* Nəsihət verən, öyüd verən, yol göstərən. [Hacı Mehdi Sənəmə:] *Başımdan açıl, ovqatımı təlx eləmə. Hələ gəlib mənə bir nəsihətçi olacaq.* Ə.Haqverdiyev.

**NƏSİHƏTÇİLİK** *is.* Nəsihət, öyüdvermə xasiyyəti (meyli). *Ədəbi əsərlərdə nəsihətçilik üsulundan uzaqlaşmaq.*

**NƏSİHƏTYANA** *zərf* Nəsihət tərzində, nəsihət yolu ilə, öyüd məqsədi ilə, doğru yol göstərmək məqsədi ilə. *Nəsihətyana danışmaq.* – [Asya nəsihətyana:] *Sən yekə qızsan, elə şeyləri başından çıxart, sən hara, bazarın gədəsi hara?* Ü.Hacıbəyov.

**NƏSİL** *is.* [*ər.*] 1. Əcdadı bir olan qohumlar silsiləsi; soy. *İkinci otaqda səfəviyyə nəslindən vəfat edən padşahların və namdar şahzadələrin təsviri çəkilmişdi.* M.F.Axundzadə. *Əsrlər, qərinələr gəlib keçir, insan nəsilləri dəyişir, .. lakin bu böyük dühalar köhnəlmir, qocalmır, çürümür.* M.İbrahimov. ☐ **Nəsli kəsilmək** – 1) tamam məhv edilmək, kökü

kəsdirilmək (bir nəsil haqqında). *Camaatın halına ağlayan, onun dərdinə dərman axtaranların nəsli kəsilir, izi itirilirdi*. H.Sarabski; 2) tamamilə kökü kəsilmək, yoxa çıxmaq. *Bəzi nadir heyvanların nəsli kəsilib*. **Nəslini kəsmək** – bir nəsli tamam qırmaq, məhv etmək, kökünü kəsmək. [Mahmud bəy:] *Əgər Pəri adı çəksən, Qara vəzir səni öldürər, mənim də nəslimi kəsər*. "Qurbani".

2. Eyni vaxtda (dövrdə) yaşayan və bir-birinə yaxın adamlar. *Bizdədir sinfi şüurun əsli; Adımızdır yeni insan nəsli*. M.Müşfiq. // Ümumi mənafe üçün fəaliyyət göstərən eyni dövrün adamları. *Azərbaycan ədəbiyyatına son illərdə qüvvətli bir nəsil gəlmişdir*. M.Hüseyn.

3. *xüs*. Heyvan və bitki sistematikasında: ümumi əlamətlərə malik bir neçə növü birləşdirən qrup.

**NƏSİLBƏNƏSİL** *sif.* Nəsildən-nəslə, nəsillər boyunca, ata-babadan tutmuş. [Zeyni baba:] *Elədir, nəyimiz varsa nəsilbənəsil talanıb*. Ə.Məmmədxanlı. *Bu əsər nəsilbənəsil böyük artistlərimiz üçün məktəb əvəzini verib*. S.Rəhman.

**NƏSİLDƏNGƏLMƏ** *sif.* Nəslə aid olan, nəsillə bağlı olan; irsi. *Nəsildəngəlmə xəstəlik*.

**NƏSİLDƏN-NƏSLƏ** *zərf* Bir nəsildən digərinə. *Yazı icad olunana qədər dərmanlar haqqında olan bilik və məlumat nəsildən-nəslə şifahi surətdə keçirdi*. S.Əliyev.

**NƏSİLLİK** *sif.* Nəslə məxsus, nəslə aid. *Nəsillik xəstəlik. Nəsillik torpaq*.

**NƏSİLLİKCƏ** *zərf* Nəslən, nəslin hamısı, bütün nəsil. *Nəsillikcə oxumuş*. – [Səməndər:] *Deyəsən, sizin nəsillikcə doğru işdən xoşunuz gəlmir?!* B.Bayramov.

**NƏSİLSİZ** *sif.* Nəsli olmayan, nəsil verməyən, övladı olmayan.

**NƏSİLSİZLİK** *is.* Nəsil verməmə, övladı olmama, nəsli olmama.

**NƏSİM** *is.* [*ər.*] Xəfif, yüngül yel; meh. *Dərənin hər iki tərəfində bitmiş yüzillik palıd və fıstıq ağaclarının budaqları ahəstə əsən nəsimdən hərəkətdədir*. M.F.Axundzadə. *Havada xəfif bir axşam nəsimi hiss edilirdi*. S.Hüseyn.

**NƏSLƏN** *zərf* [*ər.*] 1. Nəslə görə, nəsilcə. *Nəslən ərəbdir*.

2. Bütün nəsil. *Nəslən məhv olmaq*. // Nəsildən gəlmə, irsdən keçmiş. *Nəslən keçmə xəstəlik*.

**NƏSLİ** *sif.* [*ər.*] Nəsildən-nəslə keçən, bir nəslə aid olan; irsi. *Məsmənin dediyindən məlum olurdu ki, göz ağrısı* [kor kişigildə] *nəsli bir xəstəlik imiş*. S.Hüseyn. *Tərbiyə işi nəsli və irsi bir iş deyildir*. M.S.Ordubadi.

**NƏSR** *is.* [*ər.*] Roman, hekayə, novella tərzində yazılmış (qeyri-mənzum) ədəbiyyat (*nəzm* əksi). *Nəsr, dramaturgiya və publisistikada satiranın yaradıcısı Cəlil Məmmədquluzadə olmuşsa, poeziyada Sabir olmuşdur*. M.İbrahimov.

**NƏSRANİ** *is.* [*ər.* əsli qədim *yəh.*] Xaçpərəst, isəvi, xristian.

**NƏSRİN** [*fars.*] *klas.* bax **nəstərən**. *Bir əndamı nəsrin, dodağı qönçə; Bir qaməti gülbuy yarə aşiqəm*. M.P.Vaqif. *Hanı o sən görən əhmər yanaqlar; Müsəlsəl keysular, nəsrin buxaqlar?* Q.Zakir.

**NƏSTƏRƏN** *is.* [*fars.*] Ağ çiçəkli yabanı gül. *Çıxarıb baş bənövşələr yerdən; Açılır bağda nəstərən, süsən*. M.S.Ordubadi. *Ərikgülü və ya nəstərən növü Azərbaycanda bir bəzək bitkisi kimi becərilir*. M.Qasımov. // *məc. klas.* Ağ, zərif, gözəl üz mənasında. *Ol lalə isə, bu nəstərəndir*. Füzuli. *Ağ buxağı tərütazə nəstərən; İşvə ilən nazü-qəmzə göstərən*. Q.Zakir.

**NƏŞ** *is.* [*ər.*] Meyit, cənazə, ölü. *Gəlmə nəşim üstə, versəm həsrə-tindən can əgər; Qeyrlər ta olmasın agah ki, yarımsan mənim*. S.Ə.Şirvani. *Tanrıverdi soyuq və laqeyd bir tövr ilə: – Hacı Qurbanın nəşi quyudamı qalacaq? – deyə soruşdu*. A.Şaiq.

**NƏŞAT** *is.* [*ər.*] *klas.* Sevinc, şadlıq, kef. *Mey sonulduqca doğar zövq, nəşat; Ölülər içsə bulur tazə həyat*. H.Cavid.

**NƏŞƏ** *is.* [*ər.*] Kef, sevinc, ləzzət, zövq. *Mey nəşəsini zövq bilər, cam nə bilsin*. M.Ə.Sabir. [Xəlilin] *bir an sıxılan ürəyi haman açıldı, səbəbsiz bir nəşə ruhuna ha-kim oldu*. Çəmənzəminli. *Bir tərəfdən isti çayın nəşəsi və o biri tərəfdən yeni adaxlını aldatmaqdan ötrü qurmuş olduqları kələk* [Mahmudla yoldaşını] *şad edirdi*. B.Talıblı. // Yüngülcə keflənmə. *Şərabın nəşəsi*. ☐ **Nəşə vermək** – ləzzət vermək, kef vermək. *Bülbüllərin nəğmələri, meşənin və çiçəklərin ətri,*

*gecənin sərinliyi, buludsuz göydə səyahət edən ayın tamaşası çalanların və oxuyanların hamısına nəşə verirdi.* Ə.Haqverdiyev. *Burada yeni açılan həkim məntəqəsi, onun burada ağ xalat geyib müstəqil çalışması* [Sevilə] *xüsusi zövq və tükənməz nəşə verirdi.* S.Rəhimov.

◊ **Nəşəsi durulmaq (gəlmək)** – kefi açılmaq, şadlanmaq, sevinmək. *Muzdurun .. danışıqları, Pərinin gülüşləri yavaş-yavaş Qumrunun nəşəsini duruldurdu.* Ə.Əbülhəsən. **Nəşəsi qaçmaq** – əhvalı birdən pozulmaq, pərt olmaq, məyus olmaq. *Məşədi Əhmədin nəşəsi qaçdı.* S.Hüseyn. **Nəşəsini pozmaq (dağıtmaq)** – pərt etmək, məyus etmək, kefini, əhvalını pozmaq. [Qızıl it] *alaçıqdan çıxıb bir yana getdiyimi görüncə kəsik qulaqlarını oynadaraq qalın, boğuq səsi ilə hürər, nəşəmi pozardı.* A.Şaiq. [Hidayət:] *Ana, sən mənim canım, nənənin nəşəsini pozma!* B.Bayramov.

**NƏŞƏLƏNDİRMƏ** "Nəşələndirmək"dən *f.is.*

**NƏŞƏLƏNDİRMƏK** *f.* 1. Kefini açmaq, şadlandırmaq, əyləndirmək, kef vermək, ürəyini açmaq. *Xanımın sol tərəfində duran gözəl qızlar əllərindəki udu çalır və xanımı nəşələndirirdilər.* M.S.Ordubadi. // Ruh yüksəkliyi yaratmaq, ruhlandırmaq. [Kavus:] *Musiqi zəhməti nəşələndirmək üçündür.* Çəmənzəminli.

2. Kefləndirmək, məst etmək, içkidən nəşələnmək.

**NƏŞƏLƏNMƏ** "Nəşələnmək"dən *f.is.*

**NƏŞƏLƏNMƏK** *f.* 1. Şadlanmaq, fərəhlənmək, zövqlənmək, ürəyi açılmaq. *Gerçək, bu nə? Oynayıb-çalan yox; Bir nəşələnib də zövq alan yox.* H.Cavid. [Səbri] *çaldığı əsərinmi, yoxsa ürəyinə axan sevincinmi təsirindən nəşələnib bir xeyli yoldaşının üzünə baxdı.* M.Hüseyn.

2. Keflənmək, yüngülcə məst olmaq.

**NƏŞƏLİ** *sif.* 1. Şən, şad, fərəhli. *Ceyran çox nəşəli görünürdü, danışır, gülür, əylənirdi.* S.Hüseyn. *Bu gün nəşəlidir söylədiyim qız; Bir qızartı çöküb yanaqlarına.* S.Vurğun. *Könüllər nəşəli, ürəklər sərin; Bülbül kimi ötür şirin dillərin.* R.Rza.

2. Ürək açan, ləzzət verən, zövq verən; xoş, gözəl. *Nəşəli yer. – Gedirəm, yolum dağdı; Gör nə nəşəli bağdı; Çəkərəm yar qəhrini; Nə qədər canım sağdı.* Sarı Aşıq. *Ancaq birdən gözlənilməz bir hadisə bizim bu qızğın, nəşəli ovumuzu yarımçıq qoydu.* M.Rzaquluzadə.

3. Yüngülcə kefli, məst. // *Zərf mənasında.* Nəşə ilə, ləzzətlə. [Yaşlı kişi] *nəşəli bir qullab vurub tüstüsünü başından yuxarı sovuraraq, hekayəsini davam etdirməyə başladı.* S.Hüseyn.

**NƏŞƏSİZ** *sif.* və *zərf* Bikef, pərt, məyus, kefi pozulmuş. *Nəşəsiz sima. – Əşrəf Əhmədin otağından çox nəşəsiz çıxdı.* A.Şaiq.

**NƏŞƏSİZLİK** *is.* Məyusluq, bikeflik, tutqunluq.

**NƏŞƏT** *is.* [*ər.*]: **nəşət etmək** – törəmək, əmələ gəlmək, hasil olmaq, vücuda gəlmək, zahir olmaq, irəli gəlmək. *Qüvvətə bağlıdır aləmdə həyat; Qüvvətdən nəşət edir mövcudat.* A.Səhhət. *Gövhərtacın mərəzinin istəklisinin fərağından nəşət etdiyini heç kəs bilmirdi.* Ə.Haqverdiyev. [Qadının] *qarabuğdayı üzündə bir dirilik, yanaqlarında vücudunun sağlamlığından nəşət edən bir qırmızılıq, gözlərində bir dərinlik mövcud idi.* S.Hüseyn.

**NƏŞİDƏ** *is.* [*ər.*] *şair.* Şeir, mahnı, təranə. *Yadımdadır bu gün belə; Bir bəxtiyar sevinc ilə; Könlümün ilk bəstəsini; Ruhumun nəşidəsini; Oxuduğum əziz günlər.* M.Müşfiq. *Hanı ağ suların xoş nəşidəsi; Burda nə ildırım, nə şimşək çaxar.* H.Arif. // *köhn.* Bir şerin zərbi-məsəl halına düşmüş məşhur beyti, misrası.

**NƏŞR** *is.* [*ər.*] 1. Çap edib yayma, çap edilib yayılma. "*Əkinçi*"*nin nəşri öz dövrü üçün böyük tarixi hadisə idi.* ☐ **Nəşr etmək** – çap edib yaymaq. *Kitab nəşr etmək. Qəzet nəşr etmək. – Hər biri şərh edər öz əfkarın; Nəşr edər aləmara asarın.* A.Səhhət.

2. Dərc etmə, elan etmə. *Qərarın nəşrindən 2 il keçib.* ☐ **Nəşr etmək** – dərc etmək, elan etmək. *Fərman nəşr etmək.*

3. Nəşr edilmiş, çapdan çıxmış kitab, jurnal, məcmuə və s. *Azərbaycan Elmlər Akademiyasının nəşri. Kitabın ikinci nəşri.*

4. Yayma, intişar etmə, dağıtma. ☐ **Nəşr etmək** – yaymaq, intişar etmək, saçmaq. *Padşahı da mümkün imiş lağa qoymaq və onu*

*xoruz şəklinə salıb dünyaya nəşr etmək?!* C.Məmmədquluzadə. *Kiçik bir lampanın ziyası evə xəstə və ölgün bir işıq nəşr edirdi.* S.Hüseyn.

**NƏŞRİYYAT** *is.* [*ər.*] Kitab, qəzet, jurnal və s. nəşr etməklə məşğul olan müəssisə, idarə. *Azərbaycan Dövlət Nəşriyyatı. Yazıçılar İttifaqı Nəşriyyatı. Musiqi Nəşriyyatı.*

**NƏŞRİYYATÇI** *is.* 1. Nəşriyyat işçisi.

2. *köhn.* Nəşriyyat sahibi.

**NƏŞVÜNÜMA** *is.* [*ər.*] *köhn.* Böyümə, inkişaf və tərəqqi etmə, artma. *Nəşvünüma etmək. Nəşvünüma tapmaq. – Əlli sənə millətə xidmət eləmək, onun ürəyində gözəl və pakizə hissiyyatın doğub nəşvünüma tapmasına səbəb olmaq – əlbəttə, böyük hünərdir.* F.Köçərli. *Anbaan bulduqca mən nəşvünüma; Ruhumu qaplardı bitməz bir səfa.* H.Cavid.

**NƏT** *is.* [*ər.*] Məhəmməd peyğəmbərin şəninə deyilmiş mədhiyyə.

**NƏTİCƏ**[1] *is.* [*ər.*] 1. Bir işdən, hadisədən və s.-dən doğan, çıxan hər hansı başqa bir hadisə və ya vəziyyət, hal; son, aqibət. *İşin nəticəsi. Təcrübənin nəticəsi. – ..Əlbət ki, bunun bir nəticəsi olacaq, yoxsa bu işlər özbaşına deyil..* C.Məmmədquluzadə. *Mirzə Mehrəli nəticəsindən qorxurdusa da, qubernatoru qarşıladıqda nitq söyləməyi qət etmişdi.* Çəmənzəminli. ☐ **Nəticə bağlamaq** – b a x **nəticə vermək**. *Bədbəxt cavanın yuxusu tezliklə nəticə bağladı.* İ.Musabəyov. **Nəticə çıxarmaq** – müəyyən bir fikrə, qərara, nəticəyə gəlmək, ibrət dərsi almaq. [Mirzağa] *Cəmilənin hər bir hərəkətinə, sözünə ayrıca əhəmiyyət verir, öz faydasına olaraq ondan bir nəticə çıxarırdı.* S.Hüseyn. [Sevinc:] *..Mən elə bilirdim ki, sən bugünkü iclasdan özün üçün həmişəlik bir nəticə çıxaracaqsan.* Z.Xəlil. **Nəticə vermək (çıxmaq, hasil olmaq)** – bu və ya digər nəticəsi olmaq, bir şeylə bitmək, qurtarmaq. *Deyirlər ki, cavanlıqda Mirzə Səfər özü şairlik fikrinə düşüb, şeir demək üçün çox çalışmışdı, lakin bir nəticə hasil olmamış idi.* Ə.Haqverdiyev. *Qonşumun bu iftirasından bir nəticə çıxmayacağını bilib, bu barədə ona heç bir söz deməmdim.* S.Rüstəm. **Nəticəyə gəlmək** – müəyyən bir qərara, qənaətə gəlmək. *Həkim .. müayinə edir, heç bir nəticəyə gələ bilmirdi.* B.Bayramov. // **Nəticədə** şəklində, *zərf mənasında*: axırda, sonda, nəhayətdə. [Şeyda mürəttiblərə:] *..Mərhəmət xülyalarilə sürünəcək olsanız, nəticədə zillət və səfalətdən başqa bir şey bulmazsınız.* H.Cavid.

2. Bir əsərin, məqalənin və s.-nin əsas məzmununun, mahiyyətinin qısaca xülasəsi, yekunu. *Kitab bir müqəddimə, beş fəsil və bir nəticədən ibarətdir.*

**NƏTİCƏ**[2] *is.* [*ər.*] Nəvənin uşağı. *Qoca kişi gözü dolusu: – Nəticə, – dedi, – nəvənin uşağı nəticə olmurmu?* S.Rəhimov. [Tahir:] *Sən nəvə nədir, nəticəni də görəcəksən, hələ bir kötükcəni də.* M.Hüseyn.

**NƏTİCƏLƏNDİRMƏ** "Nəticələndirmək"dən *f.is.*

**NƏTİCƏLƏNDİRMƏK** *f.* Bir nəticə ilə qurtarmaq, sona çatdır-maq, başa vurmaq, nəticə əldə etmək.

**NƏTİCƏLƏNMƏ** "Nəticələnmək"dən *f.is.* [Əhməd] *işin bu cür nəticələnməsindən təəccüblənib dərin fikrə getdi.* B.Talıblı.

**NƏTİCƏLƏNMƏK** *f.* 1. Nəticəsi olmaq, bir nəticə ilə qurtarmaq, bitmək, sona çatmaq. *İş bədbəxtliklə nəticələndi.*

2. Həyata keçmək, bitmək. *İş nəticələndi.*

**NƏTİCƏLİ** *sif.* Nəticəsi olan, yaxşı nəticə verən, müvəffəqiyyətlə qurtaran. *Nəticəli zəhmət.*

**NƏTİCƏSİZ** *sif.* Nəticəsi olmayan, məqsədə çatmayan, heç bir. nəticə verməyən, sonu müvəffəqiyyətsiz, aqibətsiz. *Nəticəsiz iş.* // Zərf mənasında. *Danışıqlar nəticəsiz qurtardı.* ☐ **Nəticəsiz qalmaq** – axırı boşa çıxmaq, sonu müvəffəqiyyətsiz olmaq, heç bir nəticə verməmək. *Neçə-neçə hərbi xəstəxanada* [Zeynalın] *gözləri müalicə olunmuşdusa da, nəticəsiz qalmışdı.* B.Bayramov.

**NƏTİCƏSİZLİK** *is.* Nəticəsi, axırı olmama; müvəffəqiyyətsizlik, aqibətsizlik, uğursuzluq. *Təşəbbüsün nəticəsizliyi. Danışıqların nəticəsizliyi. – ..Şiraslanın müvəffəqiyyətsizliyindən, bu işin nəticəsizliyindən* [Solmaz] *nə qədər də ağır iztirablar keçirib, yanıqlı nəğmələr oxuyacaqdır.* S.Rəhimov.

**NƏÜZÜNBİLLAH** *köhn.* "Allah göstərməsin", "Allah eləməsin", "üzdəniraq" mənalarında ərəbcə tərkib. *Nəüzünbillah, mənim yadıma belə gəlir ki, keçən türk padşahları*

*quldurbaşı kimi bir zad imişlər.* C.Məmmədquluzadə. *Orasını demək istəyirik ki,* [Mirzə Mustafanın] *namaz qılmaqda qəsdi o idi ki, camaat onu dindar tanısın, deməsinlər ki, hərif dinsiz və nəüzünbillah, allahsızdır.* E.Sultanov.

**NƏVA** *is.* [*fars.*] 1. Avaz, ahəng, musiqi səsi. *Qoy nəva ney tək edim ta nəfəsim var mənim.* S.Ə.Şirvani. *Heyfa ki, çıxmadı tarın sədası; Ucalmadı kamançanın nəvası.* A.Səhhət.

2. İniltili səs. *Ölümlərin pəncəsində hıçqıran; Məzlumların nəvasından yarandım.* M.Müşfiq. [Xədicənin] *səsində şikayət dolu bir nəva vardı.* S.Rəhman.

3. *mus.* Azərbaycan klassik muğamlarından biri. *12 əsas muğam bunlar idi: üşşaq, nəva, busəlik, rast, əraq, isfahan, zirəfkənd, büzürk, zəngulə, rəhavi, hüseyni və hicaz.* Ü.Hacıbəyov.

**NƏVAZƏNDƏ** *is.* [*fars.*] *köhn.* Çalan, çalğıçı. *..Yenə xanəndə və nəvazəndələr gözəl nəğmələr oxuyurmu?* F.Köçərli. [Hacı Mehdi oğlu Əsgər] *Turşsu deyilən yerə qonaq çağırıb xanəndə və nəvazəndələr ilə onlara kef verərdi.* Ə.Haqverdiyev.

**NƏVAZİŞ** *is.* [*fars.*] 1. Oxşama, əzizləmə, mehribanlıq etmə, riqqət göstərmə; mehribanlıq, riqqət. *Qəhrəman həqiqətən anası Gülüşgəlindən də böyük nəvazişlər görmüşdür.* S.Rəhimov. ☐ **Nəvaziş etmək (göstərmək)** – oxşamaq, əzizləmək, riqqət göstərmək. *Ərinin sözünə əhəmiyyət verməyən Şölə xanım ona yaxınlıq və nəvaziş göstərmək istədi.* Ə.Abasov.

2. **Nəvazişlə** şəklində *zərf* – oxşayaraq, məhəbbətlə, mehribanlıqla, riqqətlə. *Sonra nəvazişlə mənə söylədi: – De, səni göndərsin atan məktəbə.* A.Səhhət. *Sonra birdən ağ saçlarını xatırlayaraq* [Ulduz] *qüssə ilə gülümsündü və nəvazişlə yaralının üzərinə əyildi.* Ə.Məmmədxanlı.

**NƏVAZİŞKAR** [*fars.*] bax **nəvazişli** 1-ci mənada. *Nəvazişkar ana. – Nizami gülümsəyərək nəvazişkar bir surətdə vəliəhdə yanaşıb: – Özünü şaşırma, – dedi.* M.S.Ordubadi. *Tahir Lətifənin nəvazişkar cavabından ürəklənərək elə bil açıqdan-açığa ona təşəkkür etmək istədi..* M.Hüseyn.

**NƏVAZİŞLİ** *sif.* Nəvaziş göstərən, əzizləyici, oxşayıcı, riqqətli, riqqətlə dolu. ..[Muradın] *sönmüş ruhuna yalnız Nigarın nəvazişli əli bir sıcaqlıq verə bilərdi.* S.Hüseyn.

**NƏVƏ** *is.* Oğlun və ya qızın uşağı. *Dövlətdə – dəvə, övladda – nəvə.* (Ata. sözü). *İzzət qarı dönüb yanında yatmış nəvəsi Qumruya baxdı.* Ə.Məmmədxanlı.

**NƏVƏ-NƏTİCƏ** *top.* Nəvələr, nəticələr hamısı birlikdə; uşaqlar, övladlar, nəsil mənasında. *Ölməz-itməz Xədicə; Görər nəvə-nəticə.* (Məsəl). [Bədircahan:] *Nəvə-nəticələrindən artıq ömür edəcəksən..* N.Vəzirov.

**NƏVVAB** *is.* [*ər.*] Naib sözünün cəmi; naiblər.

**NƏZAFƏT** *is.* [*ər.*] Təmizlik, paklıq.

**NƏZAKƏT** *is.* [*ər.*, əsli *fars.*] 1. Tərbiyə, ədəb, mərifət; ədəb qaydaları. [Müəllimin] *özündən ədəb və nəzakət xaricində heç bir hərəkət baş verməmişdi.* S.Hüseyn. *Xəlil məqsədinə nail olacağını duyaraq nəzakətini bir qat daha artırdı.* Çəmənzəminli.

2. Zəriflik, incəlik, lətafət, naziklik, gözəllik. *Cismi dolu, nazik bədəni, beli; Görməmişəm dilbər bu nəzakətdə.* M.P.Vaqif.

3. **Nəzakətlə** şəklində *zərf* – ədəblə, ədəb qaydalarını gözləyərək. *Nəzakətlə cavab vermək. Nəzakətlə yer göstərmək.*

**NƏZAKƏTLİ** *sif.* 1. Ədəbli, tərbiyəli, mərifətli. *Nəzakətli qız.* – [Günəş] *nəzakətli, ciddi və iradəli bir qadın olmuşdu.* A.Şaiq. [Xanım:] *Nə qədər nəzakətlisiniz! – dedi, – heç qarşınızda duranın qadın olduğunu düşünürsünüzmü?* H.Nəzərli.

2. *məc.* İncə, zərif, lətif, nazik, gözəl. *Böyük qız .. nəzakətli bir .. gözəl olduğunu sübut edirdi.* S.S.Axundov.

**NƏZAKƏTLİLİK** *is.* Nəzakət, ədəb qaydalarını gözləmə; ədəblilik, tərbiyəlilik, mərifətlilik, incəlik.

**NƏZAKƏTSİZ** *sif.* Ədəbsiz, tərbiyəsiz, mərifətsiz, kobud, qaba. *Nəzakətsiz adam.*

**NƏZAKƏTSİZLİK** *is.* Ədəbsizlik, tərbiyəsizlik, mərifətsizlik, kobudluq, qabalıq. [Qətibə:] *Səni sevdiyim üçün mənə əxlaqsız deməyin nəzakətsizlikdir.* M.S.Ordubadi.

**NƏZARƏT** *is.* [*ər.*] 1. Yoxlama məqsədilə baxma, göz qoyma, nəzər yetirmə, göz altında saxlama, fikir vermə, diqqət yetirmə. *Hərbi idarələr* [şəhərin] *üzərinə ciddi nəzarət*

*təyin etmişdilər*. M.S.Ordubadi. *İndi o, Qulamı öz nəzarəti altında saxlamaq istəyirdi*. Ə.Əbülhəsən. ☐ **Nəzarət etmək** – nəzər yetirmək, üstünə göz qoymaq, baxmaq, xətirdə, yadda saxlamaq.

2. Hər hansı bir fəaliyyətə nəzarət edən idarə. *Xalq nəzarəti*. // *köhn*. bax **nazirlik** 1-ci mənada.

**NƏZARƏTÇİ** *is*. Nəzarət edən, baxan: vəzifəsi bir şeyə nəzarət etmək olan; baxıcı. [Pristav] *kəndə gəlib Əhmədlə söhbət elədiyi ilk andan ondan şübhələnmiş və qərara almışdı ki, şəhərə qayıdan kimi onun adını şübhəli adamlar siyahısına yazsın, ayrıca bir qovluq düzəltsin və Əhmədin üzərinə nəzarətçi qoysun*. İ.Şıxlı.

**NƏZARƏTÇİLİK** *is*. Nəzarətçinin işi, vəzifəsi; baxıcılıq, gözətçilik, keşikçilik.

**NƏZARƏTSİZ** *sif*. və *zərf* Üstündə nəzarət (göz) olmayan (olmadan), nəzarət edilməyən, baxıcısız, heç kəs tərəfindən nəzarət edilməyən. *Nəzarətsiz əkin. Nəzarətsiz tikinti. – ..Bostanı nəzarətsiz qoymağa Qaranın ürəyi gəlmirdi*. Ə.Əbülhəsən. // Baxımsız. *Nəzarətsiz uşaqlar*.

**NƏZARƏTSİZLİK** *is*. Nəzarətsiz şeyin halı, vəziyyəti, nəzarət olmadığı hal. // Baxımsızlıq.

**NƏZDİNDƏ** [*fars*. "nəzd"dən] Yanında, idarənin tabeliyində. *İnstitutun nəzdində kitabxana var. – Məktəb nəzdində olan cəmiyyəti-xeyriyyə onun uşaqlarını dərs pulundan azad etmişdi*. Ə.Haqverdiyev. *Trest nəzdindəki qazıma idarəsinin iş sürəti artmışdısa da, Qüdrət bunu yalnız işdəki dönüşün ilk mərhələsi hesab edirdi*. M.Hüseyn.

**NƏZƏR** *is*. [*ər*.] 1. Baxma, baxış, baxmaq tərzi, gözlərin ifadəsi. *Xoş nəzərlə baxmaq. Acıqlı nəzərlərlə süzmək. Küskün nəzər. İncik nəzər. – Ey gül, nə əcəb silsileyi-müşki-tərin var; Ahu nəzərin var!* M.Ə.Sabir. [Ağsaqqal qocalar] .. *qorxaq nəzərləri ilə bizi salamladılar*. H.Nəzərli. // Göz, baxış. *..Hamının nəzəri onlara tərəf çevrildi*. Mir Cəlal.

2. *məc*. **Nəzərində** şəklində – ...gözündə, ...təsəvvüründə, ...düşüncəsinə görə. *İşlərimiz avropalıların nəzərində elə bir .. əhəmiyyətli əhvalatdır ki, .. onlar indiyədək neçə cild kitablar yazıblar*. C.Məmmədquluzadə. *..Fərruxun nəzərində tamam başqa bir aləm açıldı*. Mir Cəlal.

3. Göz, diqqət, himayə, kömək. *Səməd dərhal Nadirin yanına yüyürüb* [dedi:] – *Bacıoğlu, xoş gəlmisən, sənin nəzərin bizim üstümüzdən əskik olmasın*. B.Talıblı.

4. *məc*. Bədbəxtlik, uğursuzluq, gözə gəlmə, gözdəymə. [Qadın:] *..Mat-məəttəl qalmışam ki, bu nə bəladı, nəzərdi, gözdü, afətdi*. Mir Cəlal.

◊ **Nəzər dəymək** – bax **göz dəymək** ("**göz**"də). *Tanrıdan əhdim budur; Dəyməsin nəzər sənə*. (Bayatı). **Nəzər etmək (yetirmək, qılmaq)** – nəzər salmaq, diqqət etmək, fikir vermək, maraqlanmaq, göz yetirmək. **Nəzərdə tutmaq (saxlamaq)** – nəzərə almaq, fikirdə tutmaq, haqqında düşünmək. [Aslanov:] *Mollayev məni də çağırtdırıb, nəzərdə tut ki, bu gün bərk vuruşa bilərik*. M.Hüseyn. *Əntərzadə bütün bu mülahizələri nəzərdə tutub, bədii hissəyə hazırlıq görməmişdir*. Mir Cəlal. **Nəzərdən düşmək (çıxmaq)** – unudulmaq, yaddan çıxmaq, etibardan düşmək; gözdən düşmək. *Gövhəri-əşkim kimi düşdün nəzərdən aqibət*. S.Ə.Şirvani. [Sara:] *..Səni sevəndən sonra hər bir şey nəzərimdən çıxıb*. C.Cabbarlı. **Nəzərdən keçirmək** – gözdən keçirmək, baxmaq, göz yetirmək. *..Onların mənzillərini nəzərdən keçirdik*. M.S.Ordubadi. [Oğlan] *daş-qaşı bir-bir ehtiyatla götürüb, yanından sallanan qiymət kağızını nəzərdən keçirdi*. S.Rəhimov. **Nəzərdən qaçırmaq** – diqqətsizlik üzündən unutmaq, gözdən qaçırmaq, yaddan çıxarmaq. [Sədr:] *..Lazımi idarələr bunu nəzərdən qaçırmışlar..* C.Cabbarlı. **Nəzərdən qaçmaq** – bax **gözdən qaçmaq** ("**göz**"də). *Bu şanlı vəzifəm, inan, şübhəsiz; Mənim nəzərimdən qaçmayıb, qaçmaz*. S.Rüstəm. **Nəzərə almaq** – bax **nəzərdə tutmaq**. *Deyirəm, ölməyini, ay kişi, bir al nəzərə*. M.Ə.Sabir. **Nəzərə gəlmək** – 1) görünmək, ...kimi görünmək. *Rəngi saralmış, başının tükləri ağarmış Şaban altmış yaşında nəzərə gəlirdi*. Ə.Haqverdiyev; 2) bax **gözə gəlmək** 3-cü mənada ("**göz**"də). **Nəzərə vermək** – maraq oyatmaq, nəzər-diqqəti cəlb etdirmək, nəzərə çarpdırmaq. [Ağa Kərim:] *Sənin canın üçün bir növ ilə səni Hacı Qafurun arvadı-*

*nın yanında nəzərə verdim.* M.F.Axundzadə. [Mirzə İsmayıl:] *Sonra mən səni xanın nəzərinə verərəm.* Ə.Haqverdiyev. **Nəzəri cəlb etmək** – maraq oyatmaq, diqqəti cəlb etmək, hamının marağına səbəb olmaq. *Bu sel kimi axan müxtəlif dəstələr sırasında hamının nəzərini özünə cəlb edən Azərbaycan qadınları dəstəsi idi.* S.S.Axundov.

**NƏZƏR-DİQQƏT** *is.* [*ər.*]: **nəzər-diqqəti cəlb etmək** – hamıda maraq oyatmaq, hamının diqqətini özünə çəkmək. [Xədicənin] *başında açıq rəngli çadrası nəzər-diqqəti cəlb edirdi.* S.Hüseyn. *Bu adam, qatarı qarşılayan növbətçinin və sərnişinlərin nəzər-diqqətini cəlb etməməyə çalışaraq, stansiyadakı kiçik evlərin arasında gözdən itdi.* S.Rəhman.

**NƏZƏRƏN** *qoş.* [*ər.*] *klas.* Görə, əsasən, baxılarsa, nəzərincə. *Onun fikrinə nəzərən.* – [Mahmud bəy:] *Ümidim var ki, haqq aşıqlığına nəzərən Pərini sənə versin.* "Qurbani".

**NƏZƏRİ** *sif.* [*ər.*] 1. Nəzəriyyəyə əsaslanan, nəzəriyyə olan, nəzəriyyə ilə əlaqədar, nəzəriyyə əsasında qurulmuş. *Nəzəri əsər. Nəzəri məqalə. Nəzəri nəticə.* – [Zeynal] *musiqinin, şeir və ədəbiyyatın bəzi nəzəri cəhətlərini bilirdi.* S.Hüseyn. [Yunis] *nəzəri dərslərdən gözəl imtahan verdi.* Mir Cəlal.

2. Mücərrəd məntiqi və ya riyazi hesablamalar yolu ilə alınan. *Nəzəri hesablama.* // *xüs.* İlkin əsaslara, şərtlərə görə mümkün ola bilən, nəzərdə tutulan. *Maşının nəzəri məhsuldarlığı.*

3. Nəzəri məsələlərə həsr olunan, nəzəri məqsəd daşıyan. *Nəzəri konfrans. Nəzəri məruzə.*

**NƏZƏRİNCƏ** b a x **nəzərən**.

**NƏZƏRİYYAT** *is.* [*ər.* "nəzəriyyə" söz. cəmi] Sırf elmi-nəzəri məsələ.

**NƏZƏRİYYƏ** *is.* [*ər.*] 1. Biliyin hər hansı bir sahəsində rəhbər tutulan ideyalar sistemi, elmi sistem; ictimai-tarixi həyatın gedişində toplanmış təbiət və cəmiyyət haqqındakı biliklərin məcmusu. *İnqilabi nəzəriyyə. Ehtimal nəzəriyyəsi.*

2. Təcrübi biliyin əksinə olaraq, hər hansı bir elmin, sənətin mücərrəd məntiqi planda işlənmiş ümumi əsasları. *Nəzəriyyə ilə məşğul olmaq.*

3. Təcrübi fəaliyyət və ya həqiqi varlığın əksinə olan ümumi mücərrəd mühakimə.

**NƏZƏRİYYƏBAZ** *is.* və *sif.* [*ər.* nəzəriyyə və *fars.* ...baz] Ancaq nəzəriyyəyə, mücərrəd nəzəri mülahizələrə əsaslanan, nəzəriyyə ilə oynayan adam; yalançı alim.

**NƏZƏRİYYƏBAZLIQ** *is.* Real varlıq və ya praktik fəaliyyətdən sərf-nəzər edərək, yalnız nəzəriyyə, mücərrəd mülahizələrlə məşğul olma.

**NƏZƏRİYYƏÇİ** *is.* Elmin, incəsənətin hər hansı bir sahəsinin nəzəri məsələlərini işləməklə məşğul olan şəxs. *Nəzəriyyəçi fizik.*

**NƏZƏRİYYƏÇİLİK** *is.* Təcrübə deyil, yalnız nəzəri mülahizələrə əsaslanma.

**NƏZİR** *is.* [*ər.*] Dindar, mövhumatçı adamların, istək və arzu etdikləri bir şeyin yerinə yetiril-məsi ümidi ilə yoxsullara və ya din xadimlərinə verdikləri pul və s. *Qadınların mərsiyəxanlara ver-dikləri nəzir köhnə tuman-köynəkdən və sair şeylərdən ibarət idi.* M.S.Ordubadi. *Camaat məscid və molladan uzaqlaşmışdı. Nəzir .. də verən olmamışdı.* B.Talıblı.

**NƏZİRƏ** *is.* [*ər.*] *ədəb.* Bir şairin bir şerinə təqlidən yazılan, ya söylənən şeir; bənzətmə (2-ci mənada). *Şəhriyar .. Seyid Əzimin* "*Gəlim*" *rədifli qəzəlinə gözəl bir nəzirə də yazmışdır...* B.Nəbiyev.

**NƏZİRƏÇİ** *is.* Nəzirə yazan şair; təqlidçi.

**NƏZİRƏÇİLİK** *is.* Nəzirə yazma, bənzədərək yazma; təqlidçilik.

**NƏZİRLİ** *sif. köhn.* Nəzir üçün olan, nəzir edilmiş, nəzir məqsədilə edilən (b a x **nəzir**).

**NƏZİR-NİYAZ** b a x **nəzir**. [Murad] *vaxtilə yüzlərcə zəvvarın nəzir-niyaz gətirdikləri bu daşa diqqətlə baxdı.* S.Hüseyn.

**NƏZM** *is.* [*ər.*] Poema, şeir tərzində yazılmış və ya söylənmiş mənzum ədəbiyyat (*nəsr* əksi). ☐ **Nəzm etmək, nəzmə çəkmək** – bir hadisəni, vaqiəni nəzmlə təsvir etmək. [Ağa Zaman:] *Ağzımda söz danışıram, məsləhət edirik, bu da gəldi ki, mən altmış il bundan əvvəl olan keyfiyyəti nəzm etmişəm.* M.F.Axundzadə. *Xalqa xoş gəlmək üçün nəzm edərəm nağmə, qəzəl.* A.Səhhət. *Çəkərəm nəzmə əgər olsa da hədyan, mənə nə?!* M.Ə.Sabir.

**NƏZMƏN** *sif.* [*ər.*] Nəzmlə, mənzum olaraq, şeirlə. [M.Ə.Sabirin] *məndə bir çox nəzmən və nəsrən yazılmış məktubatı var ki, cümləsi mənim məhəlli-iqamətim olan Qori şəhərində qalıbdır...* F.Köçərli.

**NƏZMİYYƏ** *is.* [*ər.*] İranda polis, jandarm idarəsinin adı. *Axşamüstü meyiti nəzmiyyəyə apardılar*. P.Makulu.

**NIĞIRTI** b a x **nıqqıltı**. *Düşməyə hazırlananların əvvəl nığırtıları, sonra da bağırtıları mənə dad verirdi.* Qantəmir.

**NIX** *is. dan.* İnadlıq, tərslik, sözündən dönməmə. ◻ **Nıx demək** – inad göstərmək, sözünün üstündə durmaq, dediyindən dönməmək. *Atası nə qədər dəlil-dəlayil dedisə mümkün olmadı. Qız nıx dediyin dedi*. (Nağıl). [Molla Teymura:] *Sən elə salmısan padşahlığına, nıx dediyin deyirsən.* “M.N.lətif.”.

◊ **Nıx dayanmaq** – birdən susmaq, dayanmaq, davam etdirməmək. *Mənzumə yarıya çatarkən Bülənd nıx dayandı*. Ə.Əbülhəsən.

**NIQQILDAMA** “Nıqqıldamaq”dan *f.is.*

**NIQQILDAMAQ** *f.* Xəstəlikdən, ağrıdan inildəmək, zarıldamaq, şikayətlənmək, ax-uf etmək. *Bir də məni vurma, aman, səngdil; Rəhm elə, nıqqıldayıram indi mən.* M.Ə.Sabir. *Sübhanverdizadə ağ mələfəli yorğan-döşək üzərində oturaraq xəstə kimi nıqqıldayırdı.* S.Rəhimov.

**NIQQILTI** *təql.* İnilti, sızıltı, ax-uf (xəstəlikdən, ağrıdan). *Xəstənin nıqqıltısı eşidilirdi*.

**NIRÇ** *təql.* Dili basaraq, “yox” demə mənasında səs çıxartma. *Lal Hüseyn nırç edib dodağını tərpətdi*. M.İbrahimov.

**NIRÇILDAMA** “Nırçıldamaq”dan *f.is.*

**NIRÇILDAMAQ** *f.* “Yox” mənasında nırç eləmək. *Nə nırçıldayırsan? – Kətxuda nırçıldayaraq əlini havada oynatdı.* M.Hüseyn.

**NIRX** *is.* Ən zəruri ehtiyacları təmin edən mallara hökumət orqanları tərəfindən qoyulan qiymət. *Nırx kəsmək. – Gecə get cibinə beş, on manat sal; Gündüz gəlib nırxa, bahayə bir bax.* Q.Zakir. [Hacı Murad:] *Mən deyirəm, biz bazarın nırx məsələsinə qarışmayaq.* M.S.Ordubadi.

◊ **Köhnə bazara (şəhərə) təzə nırx qoymaq** – köhnə qaydaları pozaraq, zahirən yenilik yaratmaq istəyən adam haqqında istehza kimi işlənir. [Tükəz:] *A kişi, nə divan, sən köhnə şəhərə təzə nırx qoyacaqsan?* S.Rəhimov.

**NIRILDAMA** “Nırıldamaq”dan *f.is.*

**NIRILDAMAQ** *f.* Nərə çəkmək, bağırmaq, bərkdən qışqırmaq. *Maral yerə uzanıb nırnır nırıldayır*. (Nağıl).

**NITIQ** *sif.* Burnunda danışan. *Nıtıq adam.*

**NİCAT** *is.* [*ər.*] Qurtuluş, xilas; xilas olma, azad olma, qurtulma. [Mirzə Rza:] *Mən balalarımın nicatından daha əvvəl İranın nicatına ümid edib, Nəsrəddin şahın qətlinə iqdam etmişəm*. C.Cabbarlı. [Qızın] *gözləri nicat uman yazıq bir ifadə aldı.* İ.Əfəndiyev. ◻ **Nicat tapmaq** – xilas olmaq, azad olmaq, qurtulmaq. *Qadın isə öz növbəsində məhbusları gördüyü zaman onlara xeyir-dua verir və nicat tapmaları üçün Allaha yalvarırdı.* M.S.Ordubadi. **Nicat vermək** – xilas etmək, azad etmək, qurtarmaq. [Əbülhəsənbəy qıza:] *Hər nə olursa olsun, sizə buradan nicat verəcəyəm.* M.S.Ordubadi. **Nicat yolu** – qurtuluş yolu, çıxış yolu, çarə, əlac. [İskəndər xan:] *..Nə qədər fikir eləyirəm, nicat yolu tapa bilməyirəm..* N.Vəzirov.

**NİCATVERİCİ** *sif.* Qurtarıcı, xilasedici, azad edən.

**NİDA** *is.* [*ər.*] 1. Hiss, həyəcan bildirən səs. *Bu sözləri o, kövrək bir nida ilə deyərkən Tahir söhbətə ara vermək və bir daha dostunun könlünə toxunmamaq istədi.* M.Hüseyn. *Nisə xala! – deyə nida ucalanda qadın ətrafına baxındı*. Mir Cəlal.

2. Səda, səs. *Yetir itmamə kim, bu şeri Hatifdən nida gəldi.* S.Ə.Şirvani. *Sabahın bu ahəngdar musiqisini ordan-burdan ucalan insan bağırtıları, şeypur nidaları pozurdu.* M.Rzaquluzadə.

3. *məc.* Təlaş, iztirab, həyəcan. *Zəkinin gözlərində bir sual, Məmmədbağırın da gözlərində bir nida əlaməti vardı.* S.Hüseyn. *Onun danışığı da sual və nida ilə dolu olacaqdı.* Ə.Əbülhəsən.

4. *qram.* Hiss, həyəcan, arzu və istək və s. ifadə edən, dəyişilməyən nitq hissəsi; məs.: ax! ah! eh! urra! ◻ **Nida işarəsi** – nida cümlələrinin sonunda, həmçinin nida və xitablardan sonra qoyulan durğu işarəsi (!). *Sarı üçbucağın üzərində iri bir nida işarəsi görünür. Bu, şoferə xəbərdarlıqdır.* Ə.Vəliyev.

**NİFAQ** *is.* [*ər.*] Pozuşma, çəkişmə, ixtilaf; ikitirəlik. [Mirzə Heydər:] *Yol bir, məqsəd bir, əqidə bir olduqda arada nifaq mümkün deyil.* Ə.Haqverdiyev. *Kürdüstan dağlarında başlanmış bu iki çiçək .. nifaqa səbəb oldu.* S.S.Axundov. ☐ **Nifaq düşmək** – araları pozulmaq, ixtilaf törəmək, çəkişmə düşmək, ikitirəlik düşmək. *..Əmioğullarının aralarına nifaq düşməsinə səbəb olmamaq üçün anam onun getməyinə izin verir.* S.S.Axundov. *Mollanəsrəddinçilər hər vasitə ilə olursa olsun din ayrı qardaşların arasına nifaq və ədavət düşməsinə yol vermək istəmirdilər.* M.İbrahimov. **Nifaq salmaq (törətmək, etmək)** – arada ixtilaf, narazılıq, çəkişmə yaratmaq, ikitirəlik salmaq. [Calal:] [O] *indi bizi görəndə deyəcək ki, yenə uşaqlar ortalığa nifaq salırlar.* Çəmənzəminli.

**NİFRƏT** *is.* [*ər.*] 1. Bir adama, işə, hərəkətə və s.-yə qarşı dərin ikrah, kin, narazılıq hissi. *..Qıza qarşı* [Ruhnəvaz xanımın] *ürəyində anlaşılmaz bir nifrət əmələ gəldi.* Çəmənzəminli. [Qəhrəman:] *Mən* [xanımın] *hiyləgər və yağlı dilinə qarşı dərin bir nifrət hiss edirdim.* H.Nəzərli. ☐ **Nifrət etmək (bəsləmək)** – zəhləsi getmək, iyrənmək, acığı gəlmək, görmək istəməmək, kin bəsləmək. *Etmisən hüsn ilə bu aləmə şöhrət məndən; Yeri vardır edəsən axırı nifrət məndən.* S.Ə.Şirvani. *..Vaxtilə Məhsəti xanımlara nifrət bəsləyənlərin nəvələri öz babalarına nifrət bəsləyəcəklər.* M.S.Ordubadi. **Nifrət yağdırmaq** – acığını, qəzəbini, nifrətini bildirmək, kinli-kinli danışmaq. *Müsafirələrin bir çoxu: – Bu dağılmışda heç vaxt sağlam bir hava görmədik, – deyə Culfa mühitinə nifrət yağdırırdı.* M.S.Ordubadi.

2. Sonsuz qəzəb, acıq, kin, lənət bildirən nida məqamında işlənir. *Nifrət! Qan çanağı taclara nifrət! Var olsun azadlıq, bir də məhəbbət!* S.Vurğun.

3. **Nifrətlə** şəklində *zərf* – nifrət hissi ilə, öz nifrətini bildirməklə, hiddətlə, son dərəcə narazılıqla. *Təklifi nifrətlə rədd etdi. Nifrətlə cavab vermək.*

**NİFRƏTAMİZ** *sif.* [*ər.* nifrət və *fars.* ...amiz] Nifrət oyadan, nifrətə səbəb olan. *Nifrətamiz bir mənzərə. Nifrətamiz hərəkət.* // Nifrət bildirən, nifrətlə dolu, nifrətli. *Keçmişdə "millət" sözü bizim dilimizdə az işlənərdi və işləndikdə nifrətamiz bir mənanı ifadə edərdi.* F.Köçərli. *Hüseynağa qapıdaca Kərimə nifrətamiz bir nəzər saldı.* M.İbrahimov.

**NİFRƏTƏŞAYAN** *sif.* [*ər.* nifrət və *fars.* ...şayan] Nifrətə layiq, ancaq nifrətə səbəb olan; pis, alçaq, mənfur. *Nifrətəşayan adam.*

**NİFRƏTLƏNDİRİCİ** *sif.* Nifrət oyadan, nifrət doğuran, nifrət hissi oyadan; pis, alçaq. *Nifrətləndirici hərəkət.*

**NİFRƏTLƏNDİRMƏ** "Nifrətləndirmək"dən *f.is.*

**NİFRƏTLƏNDİRMƏK** *f.* Nifrət oyatmaq, nifrət doğurmaq, ikrah etdirmək. [Uşaqlar] "*atacan*" *– deyə onun üstünə gələndə, onları döyüb özündən nifrətləndirirdi.* İ.Musabəyov.

**NİFRƏTLƏNMƏ** "Nifrətlənmək"dən *f.is.*

**NİFRƏTLƏNMƏK** *f.* Nifrət etmək, zəhləsi getmək, acığı gəlmək, qətiyyən xoşlamamaq. [Əbülhəsənbəy:] *..Mən qızların bu adi və ani sevişindən olduqca nifrətlənirdim.* M.S.Ordubadi.

**NİFRƏTLİ** *sif.* Nifrət doğuran, mənfur, iyrənc.

**NİFRİN** *is.* [*ər.*] Lənət, bəddua, qarğış. [Qulu:] *Heç hara qaçmaz, arxayın ol və o pulları salamat yeyə bilməyəcək, o qədər ki, nifrin ona olunur.* N.Vəzirov. *Orda-burda tutulan toyuqların qaqqıltısı, kəndli arvadlarının qarğış və nifrini kəndlə bir olmuşdu.* Çəmənzəminli. ☐ **Nifrin etmək (yağdırmaq)** – lənətləmək, bəddua etmək, qarğışlamaq. [Hatəmxan ağa:] *..Mənə Allah lənət etsin, əgər ona nifrin edib, onu oğulluqdan çıxartmasam.* Ə.Haqverdiyev. [Sənubər] *bəlkə də var qüvvəsilə nifrin yağdırmaq, lənətləmək istədi.* B.Bayramov.

**NİGAH** *is.* [*fars.*] *klas.* Baxış, baxma, nəzər. *Həsrətli nigah. Şəfqətli nigah. – Qərəzin can isə bir tünd nigahın bəsdir; Heyfdir, atma oxun, hər biri min canə dəyər.* Q.Zakir. *Düşdükcə o istəkli səmtə nigahım; Əflakə ucaldı o zaman şöleyi-ahım.* A.Səhhət. ☐ **Nigah etmək (qılmaq)** – baxmaq, nəzər salmaq. *Nərgis gözünə nigah edərdi; Yarın gözün anıb, ah edərdi.* Füzuli. *Mən bir güləgən adəmiyəm bax bu mühitin; Sən gülmə, düşün, canına diqqətlə nigah et!* Ə.Nəzmi.

**NİGAHBAN** *is.* [*fars.*] *klas.* Gözətçi, keşikçi, qarovul. *Qeyrətü şənimi hifzində nigahban edərəm; Bir gün öz canımı hətta sənə qurban edərəm*. M.Ə.Sabir. *Sanma ki, bir ləhzə keşikçim yatır; Fikri qalıb məndə nigahbanımın.* A.Səhhət.

**NİGAR** *is.* [*fars.*] Əsil mənası "rəsm", "şəkil", "surət" olub, şeirdə məcazi olaraq "gözəl", "məhbubə" mənasında işlənir. – *Yox, – dedim! – Bir dayan! Hələ sözüm var; Gəl mənə bir danış, ey nazlı nigar!* S.Vurğun. *Bir yay aldım çıxmaq üçün şikarə; Tuş gəldim bir ahugözlü nigarə.* M.Müşfiq.

**NİGARAN** *sif.* və *zərf* [*fars.*] Təşviş içində, rahatsız, həyəcanlı, iztirablı, narahat. *Dəlilər, xanımlar Koroğludan çox nigaran idilər.* "Koroğlu". [Soltan bəy:] *Balam, o uşaqlar evdə tək qaldılar, nigarandırlar*. Ü.Hacıbəyov. [Mirzə Məmmədqulu:] *Məşədi Qulamhüseyn, mən evdən çox nigaranam.* C.Məmmədquluzadə. ☐ **Nigaran qalmaq** – bir adamın və ya bir işin tərəfindən narahat olmaq, təşvişdə qalmaq. [Qönçə:] *Cavad, nə üçün nigaran qalırsan? Mənim üç gün burada qalmağımın nə zərəri var?* B.Talıblı. [Səməd kişi:] *Ay Rüstəm, sən Allah, bircə evə xəbər ver ki, Şahmuradı şəhərə apardım, nigaran qalmasınlar..* T.Ş.Simurq. **Nigaran qoymaq** – təşvişə salmaq, rahatsız etmək, narahat etmək. *..Tapdıq öz dostunu heç vaxt nigaran qoymazdı*. Ə.Əbülhəsən. *Bu cavab Salamı .. daha da nigaran qoydu.* Mir Cəlal. **Nigaran olmaq** – b a x **nigaran qalmaq**. [Gülsüm xala:] *..Canım sənə qurban, ay bala, bilmirsən nə qədər səndən nigaran olmuşam?* E.Sultanov. [Ataş] *əmisindən nigaran olduğu kimi, əmisi oğlanlarından da çox incimişdi.* Ə.Vəliyev.

**NİGARANÇILIQ** *is.* Nigaran hal, narahat vəziyyət, narahatçılıq. *Nigarançılıq çəkmək. Nigarançılıq keçirmək. – ..Son həftələr Ulduzun gözlərinə böyük bir nigarançılıq kölgə salmışdı.* Ə.Məmmədxanlı. *Ata, ana, Zöhrə böyük nigarançılıq içində idilər. Cavadın evə gəlməsi ilə bu nigarançılıq götürüldü.* Ə.Vəliyev.

**NİGARANLIQ** b a x **nigarançılıq**. *Dördüncü məclis Şölə xanımın otağında vaqe olur. Şölə xanım və Nisə xanım qayət nigaranlıqla oturublar.* M.F.Axundzadə. *Səkinə .. uzun intizar və nigaranlıqdan silkinərək evə qayıtdı.* Mir Cəlal.

**NİHAN** *sif.* [*fars.*] *klas.* Gizli, məxfi, örtülü; gizli saxlanmış. *Varımdı sinədə dərdü-qəmi-nihan, ölürəm..* X.Natəvan. *Yandırır qəlbimi bu dərdi-nihanım, nə edim?* C.Cabbarlı. ☐ **Nihan etmək (eyləmək)** – gizlətmək, gizli saxlamaq, üstünü örtüb gizləmək. *..Əql uçar başdan, ürək oynar, cəsəddən can çıxar; Göz ucuyla hər kimə eylər nihan ima pəri!* M.P.Vaqif. **Nihan olmaq** – gizlənmək, itmək, görünməz olmaq. *Cəmalın gözümdən nihan olalı; İstərəm baxmayım dünyayə, Pəri!* M.P.Vaqif. *Günəşin axırıncı zərrələri; Üfüqün arxasında oldu nihan.* C.Cabbarlı. **Nihan saxlamaq (tutmaq)** – gizli saxlamaq, məxfi saxlamaq, gizlətmək, heç kəsə bildirməmək. *Tənha səfər etmə, gəl apar canımı, əmma; Bu sirri nihan saxla, məbada bilə zülfün.* M.Ə.Sabir.

**NİHİLİST** [*lat.* nihil – heç nə] 1. XIX əsrin 60-cı illərində Rusiyada: zadəgan cəmiyyətinin ənənə və adətlərinə, təhkimçiliyə qarşı mənfi münasibət bəsləyən raznoçin ziyalı.

2. Hamının qəbul etdiyi norma, qayda və qanunlara, prinsiplərə mənfi münasibət bəsləyən adam; ifrat skeptik.

**NİHİLİSTCƏSİNƏ** *zərf* Nihilist kimi; heç bir norma, prinsip, ənənə qəbul etməyərək. *Məsələyə nihilistcəsinə yanaşmaq.* – [Səmirə:] *Yox, Rima! Sən nahaq yerə adamlara bu cür nihilistcəsinə yanaşırsan*. M.Hüseyn.

**NİHİLİZM** [*lat.*] 1. XIX əsrin 60-cı illərində Rusiyada: burjua-zadəgan ənənə və adətlərinə, təhkimçilik ideologiyasına mənfi münasibət bəsləyən mütərəqqi ictimai cərəyan.

2. Heç bir ənənə, qayda-qanun, prinsip qəbul etməmə. [Cəlil Məmmədquluzadə] *kosmopolitizm və milli nihilizmə nifrət edirdi.* M.İbrahimov.

**NİJAD** *is.* [*fars.*] *köhn*. Nəsil, nəsəb, soy. *Nijadın sual eylədi pəhləvan*. M.Ə.Sabir.

**NİKAH** *is.* [*ər.*] Kəbin, izdivac, evlənmənin qanuni şəklə salınması. [Arvadların] *hər birisi ki, razı olsa ona dübarə Abbas Məhəmməd oğluna nikah oxuna və kəbin kağızı yazıla və hər birisi ki, razı olmasa, haman saat buraxıla..* M.F.Axundzadə. *..Bu nikah*

*hər babətdən dayımın nəslinə xoş iqbal bəxş edəcəkdir.* C.Məmmədquluzadə. ◻ **Nikah etmək (oxutmaq)** – kəbin kəsdirmək. *Qoçaq və işgüzar qızlardan olduğuna* [görə] *qayınatası Mələkdən əl çəkməyib on üç yaşında kiçik oğluna nikah etdi.* A.Divanbəyoğlu. [İmran:] *Yoxsa qoca kaftar güc ilə Gülzarın nikahını oxutdu?!* S.S.Axundov. **Nikah kəsmək** – kəbin kəsmək. [Həmzə:] *Səriyyə, bilirsən nə var? Səni Qurbana vermişəm. Bu gün nikah kəsməyə gedəcəyik.* C.Cabbarlı. *İkinci axşam da əlində Quran; Kəsdi nikahını bir uzun qazı.* S.Vurğun.

**NİKAHLANMA** "Nikahlanmaq"dan *f.is.*

**NİKAHLANMAQ** *f.* Kəbini kəsilmək.

**NİKAHLI** *sif.* Nikahı olan, nikahlanmış, kəbinli. *..Şəriətdə heç bir müsəlman dörd nikahlı arvaddan artıq arvad ala bilməz, istər xəlifə olsun, istər çoban olsun.* C.Məmmədquluzadə.

**NİKAHSIZ** *sif.* Nikahı olmayan, nikahı kəsilməmiş, qeyri-rəsmi surətdə yaşayan.

**NİKBƏT** *is.* [*ər.*] Talesizlik, bədbəxtlik, iqbalsızlıq. ◻ **Nikbət tutmaq** – hər tərəfdən bəla üz vermək, bədbəxtlik basmaq. *Nədənsə* [Hacı Sultanı] *yenə nikbət tutdu*. S.Hüseyn.

**NİKBİN** *sif.* [*fars.*] Həyatdan razı, şən, ümidli, gələcəyə inanan, gələcəyi yaxşı görən; optimist (*bədbin* əksi). *Nikbin adam. – Niyaz ruhdan düşməmişdi, o yenə nikbin idi*. M.Hüseyn. [Haşım] *yaşının 100-ə yaxınlaşmasına baxmayaraq olduqca nikbindir.* Ə.Vəliyev.

**NİKBİNCƏSİNƏ** *zərf* Nikbin əhval-ruhiyyədə, şən, gələcəyə inamla. *Şairin nikbincəsinə yazdığı əsər.*

**NİKBİNLİK** *is.* Həyatda ancaq yaxşı cəhətləri görmə, müvəffəqiyyətə, gələcəyə inanma; şən və gümrah dünyagörüşü; optimizm (*bədbinlik* əksi). *S.Vurğunun lirikasındakı nikbinlik. – Bir də aydın bir nikbinlik haradansa* [Zeynalın] *ruhunun dərinliklərindən zühur edib .. oynayırdı*. Çəmənzəminli.

**Nİ́KEL** [*alm.* Nickel] 1. Gümüşü-ağ rəngli, parıltılı, çətin əriyən metal – kimyəvi element.

2. Üzərinə nikel sürtülmüş; nikelli, nikellənmiş. *Nikel çaynik. – Kəllə pəncərələrin qabağında iki nikel çarpayı, küncdə yazı stolu qoyulmuşdu*. Ə.Vəliyev.

**NİKELÇİ** *is.* Nikel çəkən usta.

**NİKELLƏMƏ** "Nikelləmək"dən *f.is.*

**NİKELLƏMƏK** *f.* Üzərinə nikel çəkmək. *Samovarı nikelləmək.*

**NİKELLƏNMƏ** "Nikellənmək"dən *f.is.*

**NİKELLƏNMƏK** *məch.* Üzərinə nikel çəkilmək.

**NİKELLƏNMİŞ** *f.sif.* Üzərinə nikel çəkilmiş; nikelli. *..Zeynəb xala nikellənmiş, par-par parıldayan samovarı ortalığa gətirdi.* M.İbrahimov.

**NİKELLİ** *sif.* Üzərində nikel olan, üzərinə nikel çəkilmiş.

**NİKNAM** *sif.* [*fars.*] *köhn.* Yaxşı ad qoymuş, yaxşılıqla xatırlanan, yad olunan. *Həmiyyətkeş olub əhli-vətəndən ötrü bişübhə; Qazandı o bu niknamı olsun daima məzkur.* "Əkinçi".

**Nİ́KOL** *is.* [*xüs. is.*-dən] İsland mineral maddəsindən düzəldilmiş prizma.

**NİKOTİ́N** [*xüs. is.*-dən] Tütünün tərkibində olan narkotik maddə; tənbəki zəhəri.

**NİQAB** *is.* [*ər.*] 1. Duvaq, üz örtüsü. *Niqab çəkib məndən yaşınma, zalım; Pərişan olubdur mənim əhvalım*. M.P.Vaqif. *..Bu halda üçüncü qapıdan çıxmış padşahın qızı üzünün niqabını atır*. Ə.Haqverdiyev.

2. Keçmişdə döyüşçülərin, cəngavərlərin tanınmamaq və qorunmaq üçün taxdıqları üz zirehi.

**NİQABLI** *sif.* Üzündə niqab olan, üzünə niqab salmış; duvaqlı. *Qara saqqallı, üzü niqablı şəkillər xəmirlənərək taxçanın yanlarında divara yapışdırılmışdı.* S.Rəhimov.

**NİLUFƏR** *is.* [*fars.*] Suzanbağı. [Lətif dostuna:] *Yaşıl yamacdan dəstə tut. Lalə, bənövşə, nərgiz, nanə, xətmi, nilufər nə desən taparsan.* Mir Cəlal.

**NİMCAN** *is.* [*fars.*] *köhn.* Çox zəif, yarımcan. *Qonşuda lakin neçə üryan da var, – qış, boran; Giryə də var, naləvü əfğan da var, nimcan; Sən ki şəriətçisən, ey binəva, qıl həya!* M.Ə.Sabir. *Gördü qar üstündə yatıb bir ilan; Şiddəti-sərmadan olub nimcan.* A.Səhhət.

**NİMÇƏ** *is.* 1. Boşqab. *Dərin nimçə. Dayaz nimçə. – Zeynal bayaqdan bəri qabağındakı nimçədə doğramaq istədiyi bir parça əti eləcə qoyub əlindəki .. bıçağı yerə buraxdı.* S.Hüseyn.

2. Balaca mis sini. *Kürsünün üstə nimçə və üstə qoyulub samovar*. C.Məmmədquluzadə. *Yuxarıda, buxarının qabağında mis nimçəyə qoyulmuş ağ samovar pıqqapıq qaynayırdı*.. Ə.Sadıq. // Girdə, dəyirmi. ..[Mayorun] *mis nimçə kimi girdə və qırmızı çöhrəsində razılıq təbəssümləri dolandığı halda uzunçuluq edirdi*. Ə.Əbülhəsən.

**NİMÇƏVARİ** *sif.* Nimçə kimi; girdə, dəyirmi.

**NİMDAŞ** *sif.* [*fars.*] Bir qədər geyilmiş, işlənmiş, nisbətən köhnəlmiş, təzə olmayan. *Nimdaş ayaqqabı. Nimdaş xalça. – Günlərin bir günü yenə də Koroğlu bir dəst nimdaş çodar paltarı geyib, Qıratı minib beləcə gəzməyə çıxmışdı*. "Koroğlu". [Ələsgər dayı] *hər axşam nimdaş döşəkcənin üstündə oturub, bu sazı dınqıldadar və mahnı oxuyardı*. İ.Əfəndiyev.

**NİMDƏR** *is.* [*fars.*] Balaca döşək, döşəkcə. [Bülənd] *dərhal ..Nazlının saldığı nimdərin üstündə oturub yastığa söykəndi*. Ə.Əbülhəsən.

**NİMFA** *is.* [*yun.*] Qədim yunan mifologiyasına görə, daşlarda, meşələrdə, bulaqlarda və s. yaşayan təbiət ilahələri.

**NİMTƏN(Ə)** *is.* [*fars.*] Qolsuz üst qadın geyimi, gödəkcə. *Güləbətin köynək, abı nimtənə; Yaxasında qızıl düymə gərəkdir*. M.P.Vaqif. [Sayalı xala] *sonra köhnə nimtənəsinin cibindən üç manat pul çıxarıb, Xasayın yastığının altına qoyur*. Ə.Vəliyev.

**NİMTƏNƏLİ** *sif.* Nimtənə geymiş, əynində nimtənə olan. *Atlaz nimtənəli, ipək köynəkli; Yastı başı tirmə şallı Sənəm, gəl!* Xəstə Qasım.

**NİNNİ** *is.* Layla, beşik mahnısı. // Məc. mənada. *Fərivər külləkləri, gecənin qaranlığından istifadə edərək çiçəklərlə öpüşdüyü zaman, haqquşu da çinarların şaxələrində şirin yuxuya dalan minlərcə quşların ninnisini oxuyurdu*. M.S.Ordubadi. *Uzaqda bir düdük səsi yana-yana inlərdi; Mürgüləyən təbiətə qəmli ninni söylərdi*. A.Şaiq.

**NİSAR** *is.* [*ər.*] *klas.* Bağışlama, qurban etmə, vermə. *Ələsgərəm, ismim deyim aşikar; Qədir bilən dosta başü-can nisar*. Aşıq Ələsgər. ☐ **Nisar etmək** – vermək, bağışlamaq, qurban etmək. *Sənə gülşəndə nisar etmək üçün hər nərgis; Götürübdür başa altun dolu bir sim təbəq*. Füzuli. [Ağa Kərim xan:] *Bir səbəb yoxdur ki, mən Züleyxaya pis sifət göstərim, mən canımı, malımı sənin yolunda nisar etməyə hazıram*. N.Vəzirov. [Pəri Cadu:] *Belə bir zəif canımı sənin ayağının altında nisar edəcəyəm*. Ə.Haqverdiyev.

**NİSBƏT** *is.* [*ər.*] 1. Əlaqədarlıq, təəllüq, mənsubiyyət, bağlılıq, münasibət. *Bunun o işə heç bir nisbəti yoxdur. – Bu sözə nisbət sənə gəl bir hekayət söyləyim; Lütf edib qıl bir nəzər, bu müxtəsər dastanə bax*. M.V.Vidadi.

2. İki şey arasında olan münasibət, oxşarlıq, uyğunluq, qiyas. *Həqdi, gözəl çoxdu cahan içində; Ola bilməz sənə nisbət hər gözəl*. Q.Zakir. ☐ **Nisbət vermək (eyləmək)** – müqayisə etmək, oxşatmaq, bir tutmaq. *Eşqimi eyləmə nisbət özünə, ey bülbül; O sənin istədiyin fəsli-gülüstan gülüdür*. S.Ə.Şirvani.

3. *Qoş. mənasında*. Görə, aid. [Məstəli şah:] *Xanım, mənə nisbət nə qulluğunuz var?* M.F.Axundzadə. *Vəliqulu nəinki anasına nisbət, bəlkə özgələrə görə də artıq üzüyola oğlandı*. C.Məmmədquluzadə. // b a x **nisbətən**.

4. **Nisbətdə** şəklində – iki şey arasında müqayisə, hal və miqdar bildirir. [Turxan bəy:] *Ömür artdıqca həyatdakı nəşə də o nisbətdə əskilir*. H.Cavid. [Xədicənin] *rəngi bir qədər ağarmış, gözəlliyi də o nisbətdə artmışdı*. S.Hüseyn.

5. Riyaziyyatda: böyük kəmiyyətin kiçik kəmiyyətə bölünməsi. *Altının üçə* ($^{6}/_{3}$) *nisbəti*.

◊ **Nisbət şəkilçiləri** *qram.* – əşyanın, hadisənin qrammatik şəxslərdən birinə aid olduğunu bildirən şəkilçilər; məs.: *-ım, -ın, -ı* və s.

**NİSBƏTƏN** *zərf* [*ər.*] Nisbət götürülərsə, müqayisə edilərsə; görə. *Bu otaq o birisinə nisbətən böyükdür. Gecə gündüzə nisbətən sərindir*. – [Qəhrəmanini] *böyük bir həyatdan keçirib ikinci, nisbətən kiçik həyatə gətirdilər*. M.İbrahimov. *Səməndər Cəmilə nisbətən daha sadə və daha mehriban idi*. M.Hüseyn.

**NİSBƏTLƏ** 1. B a x **nisbətən**. *Zəki Məmmədbağıra nisbətlə çox qüvvətli idi*. S.Hüseyn.

2. Münasibətlə, ...görə. *Bizə, ya nə nisbətlə töhmət gəlir; Qaç, oğlan, qaç, at basdı, millət gəlir*. M.Ə.Sabir.

**NİSBİ** *sif.* Müqayisə üçün olan, qiyas və müqayisə ilə olan, başqa bir şey (şərait, vəziyyət və s.) ilə müqayisə edilməklə müəyyənləşdirilən. *Nisbi anlayış. Nisbi temperatur.*

**NİSBİLİK** *is.* Nisbi şeyin halı.

**NİSF** *is.* [*ər.*] Yarı, yarım. [Aşıq Cünun] *gecənin bir nisfinə qədər çalıb-oxudu.* "Koroğlu". [Hacı Nuru şair:] [Əvvəllər] *yanına .. nə qədər qızıl və gümüş gətirdilər, nisfindən artıq oğurladın, mis və bürünc qatıb sahiblərinə rədd etdin.* M.F.Axundzadə.

**NİSGİL** *is.* Bir şeydən dolayı daim ürəkdə qalan məmnuniyyətsizlik hissi, ürəkdə çəkilən qüssə, dərd. *Anasının sözləri Xəlilin ürəyində bir nisgil olub ölənədək qalmışdı.* Ə.Haqverdiyev. [Kərbəlayı Eyvaz:] *Yazıq Dürnisə! Nisgilin ürəyimi dağlayır!* Çəmənzəminli. ☐ **Nisgil eləmək** – özünə dərd eləmək, qüssələnmək, kədərlənmək. *Hərçənd kasıbıq, ev-eşiyimizin ləyaqəti yoxdur. Amma yenə nisgil eləmədim.* M.S.Ordubadi.

◊ **Ürəyində nisgil qalmaq** – arzusu, gözlədiyi şey vaxtında yerinə yetmədiyi üçün bir dərd olaraq ürəyində qalmaq. *Vur-tut ikicə ilin gəlini olan Geysubəyimin nisgili ürəyində, arzusu gözündə qalmışdı.* Ə.Vəliyev. *Dostum, ürəyində qalmasın nisgil; Qoy açım sirrimi, sən də eşit, bil!* R.Rza.

**NİSGİLLƏNMƏ** "Nisgillənmək"dən *f.is.*

**NİSGİLLƏNMƏK** *f.* Qəmlənmək, kədərlənmək, qüssələnmək, nisgil eləmək. *Şairin sevinci evlə bir oldu. Anası da həm sevinir, həm nisgillənirdi.* Çəmənzəminli.

**NİSGİLLİ** *sif.* Ürəyində nisgil olan, daim qüssə çəkən, dərd çəkən, dərdli görünən; məhzun, kədərli, könlü tutqun. *Nisgilli uşaq. Nisgilli qız.* // Həsrət və dərdlə dolu; kədərli, yanıqlı. *Ağıçının gözəl səsi və nisgilli ağısı adamı mütəəssir edirdi..* Çəmənzəminli. *Nisgilli sözlərin, ey igid Osman; Eylədi bağrımı daraqtək şan-şan!* H.K.Sanılı.

**NİSTAQM** *is.* [*yun.*] Göz almasının qeyri-iradi, ritmik hərəkəti ilə səciyyələnən patoloji hal.

**NİSTATİN** *is.* [*lat.*] Antibiotiklər qrupundan dərman preparatı.

**NİSVAN** *is.* [*ər.*] *köhn.* Qadın (çox vaxt tərkib şəklində işlənir). *Derdiz ki, gərəkdir açıla məktəbi-nisvan; Bir yanda dəxi məktəbi-sənət, uçitellər!* M.Ə.Sabir. [Sarıqlı molla:] *İnsaf eləyin! Əhli-nisvan nə günahın sahibidir, bəradər!* Mir Cəlal.

**NİSYAN** [*ər.*] *klas.* Unutma, yaddan çıxartma. *Vətənin neməti nisyan olmaz; Naxələflər ona qurban olmaz.* A.Səhhət. ☐ **Nisyan olmaq** – unudulmaq, yaddan çıxmaq. *İş necə oldu, onu alma xəbər; Bayaq ərz etdim, o, nisyan oldu.* M.Ə.Sabir.

**NİSYƏ** *is.* 1. Bir şeyin nağd pul olmadan alınması və ya satılması. // Bu cür alınmış, ya satılmış şeyin özü, yaxud nisyə satılmış və ya alınmış şeyin verilməli olan pulu. *Nisyə girməz kisəyə.* (Məsəl). [Məşədi Cabbar tacir:] *Molla, mənim özümün pulum var, amma tamam nisyədədir.* M.F.Axundzadə. [Hacı Rüstəmin atası] *xırman zamanı da gedib, kəndbəkənd gəzib nisyə yığardı.* Ə.Haqverdiyev.

2. *məc.* Boş, əsassız, həyata keçə bilməyən, qeyri-real. *Nisyə söhbətlər. – Gedib, vaiz deyən nisyə sözə ümmidvar olma.* S.Ə.Şirvani. *Şərifzadə ona bərk vurulmuşdu. Ancaq həkimin nisyə məhəbbətlə arası yox idi.* M.Hüseyn.

**NİŞ** *is.* [*fars.*] b a x **neştər**. *Nuşun dadan, nişin də dadmalıdır.* (Ata. sözü). [Məstavər:] *Gör mən sənə neylərəm, a dərviş; Gəlcək sənə öylə sancaram niş; Ta xalq tamam vəhşətə gəlsin.* Ü.Hacıbəyov.

**NİŞAN** *is.* [*fars.*] 1. Əsər, əlamət, iz. *Vidadi xəstəni gəl indi tanı; Hanı o sən görən şəklü-nişanı?* M.V.Vidadi. *Amma sənin itəcəkdir ad-sanın; Qalmayacaq yer üzündə nişanın.* A.Səhhət. *Coşqun irmaq kənarında; Nə qızlardan bir nişan var; Nə oğlanlar islıq çalır; Nə qaynayan, nə coşan var.* Ə.Cavad. ☐ **Nişan qoymaq** – sonradan tanımaq, bilmək üçün işarə vurmaq, qeyd eləmək, nişanlamaq. *Kitabın səhifələrinə nişan qoymaq. – İndidən çıxın, otaq seçin, nişan qoyun! Hazır olan kimi ora köçün!* Mir Cəlal. **Nişan vermək** – tanıtmaq, göstərmək, bildirmək, adını vermək. [Heydər bəy:] *A kişi, bilmirəm hansı ağzıdağınıq naçalnikə məni nişan veribdir.* M.F.Axundzadə. [H.Ərəblinskini] "*böyük artist*" *– deyə bir-birinə nişan verirdilər.* S.Rəhman.

2. Bir şeyi digərindən ayıran əlamət, tanınmaq üçün qoyulan işarə; nişanə. *Ərəb atın dastanını söylərəm; Üç yaşında hər nişanı bəlli olur.* "Koroğlu". [Hacı Mehdi:] *Övrətin bir para nişanların* [Gülpəriyə] *sadaladım*. Ə.Haqverdiyev. // Yaxşı olmuş yaranın qalmış izi, əlaməti, yeri. *Üzündə qılınc yarasının nişanı var. Qolunda güllə nişanı var.*

3. Güllə, ox və s. ilə vurulmalı olan hədəf, nöqtə; nişanə. *Nişanı vurmaq*. ☐ **Nişan almaq (götürmək)** – silahı hədəfə tuşlamaq, yönəltmək. [İlyas:] *Mən irəli atıldım və bir qızdırma içərisində Tərlanın altındakı qaşqanı nişan alaraq, lap yaxında tətiyi çəkdim.* Ə.Məmmədxanlı. *Nişan alıb ox atmağı, nə çarə; Daş ürəkli mələklərdən öyrəndim.* M.Müşfiq. **Nişana qoyub atmaq** – hədəf edib güllə ilə vurmaq. *Ovçu ov tapmayanda öz papağını nişana qoyub atar.* (Ata. sözü).

4. B a x **nişangah** 2-ci mənada.

5. Hər hansı bir xidmət və ya hər hansı bir hadisənin xatirəsinə görə bir təşkilat tərəfindən verilən üstü yazılı, şəkilli metal və s.-dən hazırlanmış xüsusi lövhəcik. *Universitet nişanı. Döş nişanı. Qızıl nişan. – Səttarzadə Gəldiyevin döşündəki .. nişanına baxıb dedi: – Yaxşı igid dayısına çəkər*. Mir Cəlal.

6. Oğlan tərəfindən qızı nişanlamaq məqsədilə göndərilən üzük, şirni və s. şeylər. *Nişan üzüyü. Nişan xonçası. Nişan paltarı.* – [Orxan:] *Üzük, nişan yalnız könüldür, könül; Olma çocuq, sən gəl mənə ver könül.* H.Cavid. [Yunis Yaquta:] *Bu nişan pozulmalıdır.* Ə.Məmmədxanlı. ☐ **Nişan qoymaq (taxmaq, vermək, aparmaq)** – qızı nişanlamaq, üzük vermək, ad eləmək. [Sultan bəy:] *..Bu gün-sabah nişan qoyular, kəbin kəsilər, toy olar*. Ü.Hacıbəyov. *Nəriman inşaat mühəndisi diplomunu alan günün sabahı Kərim bəy yaxın yoldaşları ilə əncirli həyətə nişan apardılar*. Mir Cəlal.

**NİŞANBAZLIQ** *is.* b a x **adaxlıbazlıq**. [Laçın bəy:] *..Nişanbazlığa getmişmiş, bədbəxt, evdə duyublar .. nə yemisən turşulu.., vurublar ha..* N.Vəzirov. *Mehtər Zamanın dünya vecinə deyildi. Əlindəki dəsmalında sovqatı, ayağında qıvraq çarığı şəhərin yavıqlığındakı kəndə nişanbazlığa gedirdi*. Çəmənzəminli. // Nişan vermə, nişan alma işi. *Nişanbazlıq adəti. – Köçəbə tayfalar arasında* (*məs.*: *Qazaxda, Borçalıda, Qarabağda*) *qudalıq əvəzinə nişanbazlıq adəti vardır.* R.Əfəndiyev.

**NİŞANBƏNİŞAN** *zərf* [*fars.*] Bütün nişanları, əlamətləri, xüsusiyyətləri ilə. *Nişanbənişan tanıtmaq. Nişanbənişan soraq vermək.* – [Xudaverdi:] *Əyərçi oğlum nişanbənişan səni* [Hacı Qaranı] *deyirdi*. M.F.Axundzadə.

**NİŞANÇI** *is.* 1. Mahir nişan atan, düzgün nişan vuran; snayper. *Dəstədə on nəfər əla nişançı, iki də şəfqət bacısı vardı.* M.Hüseyn. *Nişançılar dərhal kamanlarını çiyinlərindən çıxardıb, xurma ağacları içərisinə yüyürürlər.* Ə.Məmmədxanlı.

2. *hərb*. Odlu silahla silahlanmış piyada əsgəri. // Sif. mənasında. *Nişançı polku* (*diviziyası*).

**NİŞANÇILIQ** *is.* Nişana atmaqda məharət, hədəfə vurmaq məharəti; snayperlik.

**NİŞANƏ** 1. B a x **nişan** 1, 2 və 3-cü mənalarda. *Mənə gizlin bir nişanə göndərdin; Aşkara başıma qaxmağın nədir?* M.P.Vaqif. *Gövhər özünü küçəyə atdı, qızdan bir nişanə görmədi*. Çəmənzəminli. ☐ **Nişanə olmaq** – hədəfə çevirmək, hədəf yeri olmaq. *Cəfa oxunu atır qeyrə ol yeganə, haray; Xədəngiqəmzəsinə olmadım nişanə, haray!* S.Ə.Şirvani.

2. *is.* Bir şeydən nümunə. *Parçadan nişanə göstərmək. – Vidadi xəstədən Bağdad elinə; Siz yetirin bir nişanə, durnalar!* M.V.Vidadi. *Bir yana sifariş eliyəndə bir nişanə göndərmək qədim adətlərin biridir*. C.Məmmədquluzadə.

3. *is.* Ölən adamdan sonra qalan miras, övlad, şey mənasında. *Bu uşaq ailədən qalan yeganə nişanədir. – Qəriblikdə ölənin börkü nişanə gərək.* (Məsəl). *Mən öldüm, anam qaldı; Oduma yanan qaldı; Bir balam, bir də atım; Mənim nişanəm qaldı.* (Bayatı).

**NİŞANGAH** *is.* [*fars.*] 1. B a x **nişan** 3-cü mənada.

2. Odlu silahlarda: hədəfi nişan almaq üçün lülə üzərində çıxıntı. *İskəndər kişi onların qaraltısını görürdüsə də, tüfəngin nişangahını seçmirdi.* M.Hüseyn.

3. Bir şeyə, hadisəyə xatirə olmaq üçün nişan qoyulmuş yer, nişan basdırılan yer; nişanə. *Dağ başında varsa da bir nişangah; Ətrafını basmış vəhşi gül, giyah.* A.Səhhət. [Yunis] *nişangahları yoxlayıb ağacdan sağa-sola ağ torpaq tökülən xətti bir də qələmlə işarə etdi.* Mir Cəlal.

**NİŞANLAMA** "Nişanlamaq"dan *f.is. Ailənin başqa üzvləri də altdan-altdan gah Şəmsiyyəyə, gah Səlimiyə baxır, bugünkü naharı rəsmi nişanlama kimi bir şey hesab edirdilər.* M.İbrahimov.

**NİŞANLAMAQ** *f.* 1. Cizgi, nöqtə və s. vasitəsilə nişan qoymaq, başqalarından fərqləndirici işarə qoymaq. *Kitabın səhifələrini nişanlamaq. Pəncərəni nişanlamaq. – Turab Rəşidi buraxıb, qızın dalınca getdi, onun girdiyi evi nişanladı.* M.Hüseyn.

2. Ad eləmək, üzük taxmaq, adaxlamaq. *Üç gün sonra "getmirəm" – deyə ağladığına baxmayaraq*, [Gülzarı] *nişanladılar*. C.Cabbarlı.

3. Nişanaya almaq, tuşlamaq. [Dursun] *..özünü toplayıb geri dönür və ayını nişanlayıb iki qolları arasından vurur*. A.Şaiq. *Qabaqda, düşmənin komandanını; Xumar nişanlayıb "tökdü qanını"*. S.Vurğun.

**NİŞANLANDIRMA** "Nişanlandırmaq"dan *f.is.*

**NİŞANLANDIRMAQ** b a x **nişanlamaq** 2-ci mənada. *İkinci xəbər bu idi ki, bacısını dayısı nişanlandırmışdı*. S.Rəhman.

**NİŞANLANMA** "Nişanlanmaq"dan *f.is.*

**NİŞANLANMAQ** *məch.* 1. Bir nişan və ya fərqləndirici işarə qoyulmaq.

2. Ad olunmaq, nişan taxılmaq, adaxlanmaq. *Bir həftə sonra doktor, Zibeydənin nişanlanmağını eşitdi*. Çəmənzəminli. *Bilmədən öylə nişanlandı ərə; Tutulub qaldı tükənməz kədərə*. M.Müşfiq.

**NİŞANLATMA** "Nişanlatmaq"dan *f.is.*

**NİŞANLATMAQ** *t-li*. Nişan taxdırmaq, üzük verdirmək, ad elətdirmək.

**NİŞANLI** *sif.* 1. Adaxlı, nişanlanmış, ad edilmiş, deyikli. *Nişanlı qız. Nişanlı oğlan*. // İs. mənasında. *Dedi, nişanlıyam, özgə malıyam; Sındı qol-qanadım, yanıma düşdü.* Aşıq Ələsgər. *Gülsüm, yəni Vəliqulunun nişanlısı Vəliqulunu görcək çadirşəbə bürünüb, pambıq boğçası kimi çəkilib oturdu qaranlıq bucaqda.* C.Məmmədquluzadə.

2. Nişanı olan, nişan taxmış, nişan vurmuş. *Döşü nişanlı əsgər*. – [Əmiraslan:] *Kişi, .. başında nişanlı papaq uşaq gördünmü?* S.S.Axundov. *Başqasının alnı qanlı; Polad köksü üç nişanlı*. S.Vurğun.

**NİŞANSIZ** *sif.* Heç bir nişanı, əlaməti, izi olmayan. *Bu oxu kim atıb, nişansız hədəf; Hara dəyəcəkdir bu ox görəsən?* S.Tahir.

**NİŞASTA** *is.* [*fars.*] 1. Bitkilərdən hasil edilən tərkibi una oxşar karbohidrat: kraxmal. *Nişasta zavodu*.

2. Bəzi bitkilərdən hazırlanan ağ, dadsız ovuntu (yeyinti, kimya, toxuculuq sənayesində işlənir). *Kartof nişastası. Düyü nişastası.* ◻ **Nişasta vurmaq** – b a x **nişastalamaq**. [Bəhlul:] *..Nazlının nişasta vurub ütü çəkdiyi təzə qardan da ağ köynəyi geymişdim*. B.Bayramov.

**NİŞASTALAMA** "Nişastalamaq"dan *f.is.*

**NİŞASTALAMAQ** *f.* Dəyişək döşəkağı və s. bu kimi şeylərə parıltı, bərklik vermək üçün nişastalı suya salmaq, nişasta vurmaq; kraxmallamaq. *Balışüzlərini nişastalamaq*.

**NİŞASTALANMA** "Nişastalanmaq"dan *f.is.*

**NİŞASTALANMAQ** *məch.* Nişasta vurulmaq, nişastalı suya salınmaq; kraxmallanmaq. ..[Muradın] *nişastalanıb ütülənmiş, yaxası açıq ağ köynəyinə baxdım.* İ.Əfəndiyev.

**NİŞASTALANMIŞ** *f.sif.* Nişasta vurulmuş; nişastalı suya salınmış; kraxmallanmış. *Üzərində ağ və nişastalanmış əl dəsmalları ehram kimi düzülən ağ örtüklü stollarda sükut hökm sürürdü*. M.S.Ordubadi. [Zülfüqar oğlanın] *.. nişastalanmış, ancaq maşında əzilib-qırışmış parusin köynəyinə nəzər saldı.* B.Bayramov.

**NİŞASTALI** *sif.* 1. Nişasta vurulmuş, nişastaya salınmış; kraxmallı. *Nişastalı yaxalıq. – Əynində qara bir libas; Başında nişastalı ləçək.* N.Rəfibəyli.

2. Tərkibində nişasta olan. *Kartof nişastalı bitkidir.*

**NİŞASTASIZ** *sif.* 1. Nişasta vurulmamış; kraxmalsız. *Nişastasız döşəkağı*.

2. Tərkibində nişasta olmayan.

**NİTQ** *is.* [*ər.*] 1. Danışma, fikrini sözlərlə ifadə etmə qabiliyyəti. *Nitq üzvləri. Nitqi inkişaf etdirmək*. // Danışıq, danışma tərzi;

tələffüz. *Aydın nitq. Rəvan nitq*. // Ümumiyyətlə, danışma, söz, kəlam. [Xurşid:] *Sən mənimtək naçizin nitqin əcəb təqdir edib; Xalq ara timsal olub sənətə etdin ibtida*. Ü.Hacıbəyov. *O tayda çadrasız dolaşan qadına; Sual ver, nitqindən saçılsın ildırım*. M.Müşfiq. ◻ **Nitqdən düşmək (qalmaq)** – danışa bilməmək, susmaq, lal olmaq, dili tutulmaq. *Nitqdən düşdüm ləbi-ləli-dürəfşanın görüb*. Füzuli. *Onun sanki dili nitqdən qalmışdı*. Mir Cəlal. **Nitqə gəlmək** – danışmağa başlamaq, dilə gəlmək. **Nitqi açılmaq** – danışmağa başlamaq, dili açılmaq. [Hacı:] *Şərab həmişə insanın mizacını açır, kefini yüksəldir, görürsən ki, şairin təbi gəlir, natiqin nitqi açılır*. B.Talıblı. **Nitqi tutulmaq (bağlanmaq, batmaq, kəsilmək, qurumaq, çəkilmək)** – danışa bilməmək, dili tutulmaq, danışmaq qabiliyyətini itirmək (sevincdən, fərəhdən, həyəcandan və s.-dən). *Könlüm açılır zülfi-pərişanını görgəc; Nitqim tutulur qönçeyi-xəndanını görgəc*. Füzuli. *Molla Tarıverdi başladı yarpaq kimi titrəməyə və nitqi kəsilib daha danışa bilmədi*. E.Sultanov. *Sual* [Şirəlini] *elə sarsıtdı ki, bir neçə saniyə nitqi qurudu*. S.Rəhman. *Eşitdiyi sözlərdən sanki* [ovçunun] *nitqi batmışdı*. Ə.Məmmədxanlı.

2. İclasda, yığıncaqda, mitinqdə və s.-də camaata, dinləyicilərə xitabən irad olunan söz. *Hərdənbir teleqramlarda vəkillərimizin nitqlərini oxuyub günümüzü bir tövr keçiririk*. C.Məmmədquluzadə. *Kəndliləri yeni quruluşun qanunu ilə tanış etmək və onların biliklərini artırmaq üçün kənd camaatına tez-tez nitq və məruzələr oxuyurdular*. S.S.Axundov. ◻ **Nitq irad etmək** – nitq söyləmək. *Edərək hər tərəfdə nitq irad; Xəlqi dəvətlə eylədik irşad*. H.Cavid. **Nitq söyləmək** – kütləvi yerlərdə, yığıncaqlarda müəyyən məsələ ətrafında danışmaq, fikir söyləmək, çıxış eləmək.

**NİTQPƏRDAZ** *is*. [*ər*. nitq və *fars*. ...pərdaz] Nitq söyləməyi sevən, həmçinin nitq söyləmək qabiliyyəti olan (çox vaxt istehza məqamında deyilir). *Həmişə nitqpərdaz olan Ağasəfər indi nə üçünsə zıqqana-zıqqana bir-iki söz güclə dedi*. Ə.Əbülhəsən.

**NİTRASİYA** *is*. [*yun*.] Üzvi birləşmələrin molekullarına nitro qrupu daxil edilməsi.

**nitr**..., **nitro**... [*yun*.] Azota aidlik bildirən kimyəvi, bioloji və s. terminlərin tərkib hissəsi; məs.: nitridlər, nitrifikasiya.

**NİTROQLİSERİ́N** [*yun*.] Təbabətdə işlənilən, qan damarlarını genişləndirən dərman preparatı. *Xəlilov uzun xiyabandakı ağac skamyada yanakı oturub.. nitroqliserin atırdı*. M.Hüseyn.

**NİVAL** *sif*. [*lat*.] Qarlı, soyuq. *Nival iqlim*.

**NİVXLƏR** Amur çayının aşağı tərəfində və Saxalin adasında yaşayan xalq (giləklərin köhnə adı).

**NİYABƏT** *is*. [*ər*.] Vəkillik, naiblik.

**NİYAZ** *is*. [*fars*.] *klas*. 1. Yalvarış, yalvarma, mərhəmət istəmə, rica. ◻ **Niyaz etmək (qılmaq)** – yalvarmaq, mərhəmət istəmək, təmənna etmək.

2. *köhn*. Allah yolunda verilən şey, nəzir, sədəqə. *Niyaz vermək*. – *Dua və niyazdan bir nəticə çıxmadığını görən Məşədi Qulu ikinci arvad almaq sevdasına düşmüş*.. T.Ş.Simurq.

**NİYƏ** "Nə üçün?", "nə səbəbə?", "nəyə görə?" mənalarında işlənən sual əvəzliyi (bəzən "niyə görə?" şəklində işlənir). *Niyə dünən gəlmədin? Niyə bu işə razı oldun?* – [Telli:] *Nə üçün, ay xanım, niyə elə danışırsan?* Ü.Hacıbəyov. [Kazım Kərbəlayıya:] *Niyə gözünü-zadını ağardırsan? Səndən qorxan yoxdur!* Çəmənzəminli.

**NİYYƏT** *is*. [*ər*.] 1. Məqsəd, məram, qəsd. *Oxumaq niyyəti var. Niyyətini demək. Ov niyyətində olmaq*. – *Niyyətin hara, mənzilin də ora*. (Ata. sözü). [Fərraşbaşı:] *Bəli, Hacı Rəcəbəli Ağa Mərdan və Ağa Salmanın niyyətini duyub, şahzadəyə bildirmişdi*. M.F.Axundzadə. ◻ **Niyyət etmək (eləmək, qoymaq)** – bir iş görmək arzusunda, məramında olmaq. [Sitarə:] *Gəl toyumuz barəsində niyyət eləyək, gedək bayıra, qulaq asaq, görək kim nə eşidər*. C.Cabbarlı. [Fərəc:] *Yox, niyyət eləmək azdır, Fizzə xanım, gərək ümumi iş uğrunda mübarizə edəsən!* Ə.Məmmədxanlı. **Niyyətdən düşmək** – bir işi yerinə yetirmək fikrindən əl çəkmək, məramından vaz keçmək. [Əsgər bəy:] *Heydər bəy, bu niyyətdən düş, mənə bir on beş gün möhlət ver, mən sənə toyxərci hazır edim*. M.F.Axundzadə. **Niyyəti yerinə gəlmək (baş tutmaq)** – arzusuna çatmaq, məramına, məqsədinə yetmək.

*Tale atanın xətrini sındırmadı, Kərimbəyin niyyəti yerinə gəldi.* Mir Cəlal. ...**niyyətinə düşmək** – bir şeyin qəsdində olmaq, bir şeyi məqsəd kimi qarşısına qoymaq, özünə məqsəd etmək. [Xəlil] *o zaman Xədicəyə rast gəlmiş, evlənmək niyyətinə düşmüşdü.* Çəmənzəminli.

2. **Niyyətlə** şəklində *zərf* – ...məqsədlə, ...arzusu ilə, qarşısına məqsəd qoyaraq (əsasən, "o", "bu" işarə əvəzlikləri ilə işlənir). *Girdim bağa üzümə; Tikan batdı dizimə; Niyyətlə evdən çıxdım; Yar göründü gözümə.* (Bayatı). *Lotular bu niyyətlə evdən çıxıb padşahın imarətinə tərəf gəlməkdə oldular.* "Aşıq Qərib". [Mozalanbəy:] *Mən Qafqazı səyahət edirəm və bu niyyətlə Gəncəyə gəlmişəm.* Ə.Haqverdiyev.

**NİYSAN** *is.* [*sür.*] Aprel (canlı dildə "leysan" şəklində işlənir). *Niysan yağışı.* // Niysanda yağan yağış.

**NİZA** *is.* [*ər.*] *köhn.* Çəkişmə, mübahisə, tutaşma, küsüşmə, qovğa, ixtilaf. *Firqələr təşkil edilmiş anbaan; Olmamış əskik niza heç bir zaman.* H.Cavid. [Aslan:] *Ər ilə övrət arasında birlik olmayıb, niza, nifaq olarsa, onların övladları necə ittifaqa, ittihada nail ola bilərlər?* İ.Musabəyov. □ **Niza etmək (eyləmək)** – mübahisə etmək, bəhsləşmək, küsüşmək, dalaşmaq. *Canı canan diləmiş, verməmək olmaz, ey dil; Nə niza eyləyəlim, ol nə sənindir, nə mənim.* Füzuli.

**NİZAM** *is.* [*ər.*] 1. Qayda, tərtib, üsul. *Nizam yaratmaq, – ..Hacı Məcid Əfəndi cümə məscid mədrəsəsinin nizamını pozdu.* C.Məmmədquluzadə. □ **Nizam qoymaq** – qayda-qanun yaratmaq. [Mirzə Rza Fərhada:] *İranda dəmir yol çəkmək istəyirdin, İranda nizam qoymaq istəyirdin*. C.Cabbarlı. **Nizama düşmək** – qaydaya düşmək, yoluna düşmək. *Kasıb kəndçilər firqəyə yazılırdılar, fəqət işlər hələ yaxşı bir nizama düşməmişdi*. E.Sultanov. **Nizama salmaq (qoymaq)** – qaydaya salmaq, tənzim etmək, qayda yaratmaq, yoluna salmaq. *Tələbə məclisi nizama saldı, lakin söylənən sözlər heç kəsi kafi dərəcədə məmnun etmədi.* Çəmənzəminli. [Mirzə Sadıq:] *Əvvəllər şah özü məmləkəti nizama salmaq istəyirdi.* C.Cabbarlı. **Nizamdan düşmək** – dağılmaq, pozulmaq, səliqədən düşmək.

2. Sıra, cərgə, səf, düzülüş. □ **Nizama durmaq** – sıralanmaq, cərgəyə durmaq, səf bağlamaq. *Yenə düşmən gəlib nizama durdu; Naçalnik mat qalıb boynunu burdu.* "Qaçaq Nəbi".

3. **Nizamla** şəklində *zərf* – müəyyən qaydada, müəyyən üsulla, tərtibatla, düzgün sıra ilə, sistemlə. *Kitabları nizamla düzmək. Şagirdləri nizamla oturtmaq. – Yenə öz sürünü nizamla düzüb; Baş alıb gedirsən hayana, ceyran?* S.Vurğun.

**NİZAMİ** *sif.* [*ər.*] 1. Düzgün, tərtibli, mütəşəkkil, müntəzəm.

2. Ardıcıl hərbi hazırlıq keçmiş. *Bir dəfə bizə əmr etdilər ki, orduda aşpaz olanlar bir tərəfə, nizami soldatlar isə başqa tərəfə keçsin.* S.Vəliyev. □ **Nizami qoşun** – ardıcıl hərbi hazırlıq görmüş və möhkəm hərbi təşkilatı olan daimi qoşun. *Hər tərəfdə fədai və nizami qoşun nəfərləri intizamı qoruyurdu.* M.İbrahimov.

3. Hərbi, əsgəri, rəsmi. *Nizami geyim. – Onun ayağındakı uzun-boğaz çəkmələr, əynindəki nizami pencək .. varlığının ayrılmaz bir parçası idi.* M.İbrahimov.

**NİZAM-İNTİZAM** *is.* [*ər.*] Müəyyən edilmiş qayda, üsul, qayda-qanun. *İşdə nizam-intizama riayət etmək. – Qabaq cərgələrdə nisbətən nizam-intizam vardı.* S.Rəhman. *Ey oğul, bil ki, adi adamların işlərində müəyyən bir qayda-qanun, nizam-intizam olmaz, onlar bir şeyin vaxtı olub-olmadığına fikir verməzlər.* "Qabusnamə"

**NİZAMLAMA** "Nizamlamaq"dan *f.is.*

**NİZAMLAMAQ** *f.* Nizama salmaq, qaydaya salmaq, müəyyən sistemlə düzmək.

**NİZAMLANMA** "Nizamlanmaq"dan *f.is.*

**NİZAMLANMAQ** *f.* Nizama salınmaq, müəyyən qayda və sistemlə tənzimlənmək.

**NİZAMLAYICI** *sif.* 1. Nizama salan, qoyulmuş nizamı, qaydanı həyata keçirən. *Küçə uzunu təhlükəsizlik xətləri çəkilir, habelə nizamlayıcı milis nəfərinin budkası və işıq fənərlərinin sütunları qoyulur.* (Qəzetlərdən).

2. *tex.* Mexanizmin düzgün işləməsini avtomatik surətdə təmin edən qurğu. *Nizamlayıcı boru*.

**NİZAMLI** 1. Bax **nizami**. [Məmmədhəsən ağa:] *Rusiyyə ilə, – dedi, – anlaşmaq*

*lazımdır, vaxta ki, özləri də buna müştaqdır, böyük məmləkətdir, nizamlı qoşunu var*. Çəmənzəminli.

2. İntizamlı, nizam və intizama, qoyulmuş qayda-qanuna ciddi riayət edən. *Nizamlı şagird.*

**NİZAMNAMƏ** *is.* [*ər.* nizam və *fars.* namə] Hər hansı bir şeyin icrası və tətbiqi üçün müəyyən üsul və qaydalar; qanun, qərar, əmrnamə. *Nizamnamə üzrə hərəkət etmək.* // Hər hansı təşkilatın fəaliyyətini, quruluşunu müəyyən edən qanunlar toplusu; əsasnamə. *Partiya nizamnaməsi.* – [Nəriman Nərimanov:] *Azərbaycan dram cəmiyyətinin yaradılması haqqında məsələ qaldırılır, lakin çar hökuməti nizamnaməni təsdiq etməyə razılıq vermir.* Ə.Haqverdiyev.

**NİZAMSIZ** *sif.* və *zərf* 1. Səliqəsiz, qaydasız, qarmaqarışıq. *Nizamsız ev.* – *Qız saçı, başı nizamsız özünü bayıra atır.* H.Sarabski. *Elə həmən gün Ülkər; Açaraq dolabları; Töküb yerə nizamsız; Düzülmüş kitabları*. B.Vahabzadə.

2. Pərakəndə, dağınıq, qeyri-müntəzəm. *Nizamsız qoşun.* – *İraq və Bağdad qoşunu bütün qərargahını və ərzaq şeylərini, silah və yük mallarını buraxıb nizamsız və pozğun bir surətdə qaçmışdı.* M.S.Ordubadi. *Canım, heç başsız da iş yaranarmı? Nizamsız ordunun mənası varmı?* S.Vurğun.

**NİZAMSIZLIQ** *is.* 1. Tərtibsizlik, qaydasızlıq, səliqəsizlik, qarı-şıqlıq, dağınıqlıq. *Səltənət dərsə gedəndən sonra bəzən evdə nizamsızlıq olurdu.* Mir Cəlal.

2. Qayda-qanunsuzluq, hərc-mərclik, qarmaqarışıqlıq, intizamsızlıq. *Bir neçə vaxt kəndə böyük nizamsızlıq düşmüşdü.* N.Nərimanov. // Qanun və nizama zidd hərəkət. □ **Nizamsızlıq etmək** – qayda-qanunu pozmaq, qarışıqlıq salmaq. *Hər kəs nizamsızlıq etsəydi onu cərimə edərdilər*. H.Sarabski.

**NİZƏ** *is.* [*fars.*] *köhn.* Uzun ağaca keçirilmiş ucu şiş, deşici qədim silah; cida, mizraq. *Qarovul çiynində nizə o tərəf-bu tərəfə gəzir və bəzən nizəsinə söykənərək mürgüləyirdi.* M.S.Ordubadi. *O gündən şair Afaq ilə bərabər bağçalarının torpağını insan qanından, paslanmış nizə, qalxan və qılınc parçalarından təmizlədilər*. Ə.Məmmədxanlı. // Süngü.

**NİZƏÇİ** *is. köhn.* Nizə ilə vuruşan; nizə gəzdirən, nizə ilə silahlanmış əsgər.

**NİZƏLƏMƏ** "Nizələmək"dən *f.is.*

**NİZƏLƏMƏK** *f.* Nizə ilə vurmaq, nizə ilə deşmək.

◊ **Ürəyini nizələmək** – b a x **ürək**.

**NOĞUL** *is.* İçərisinə keşniş tumu qoyulmuş xırda, üstü kələ-kötür, yumru şirni növü. *Xalq batıbdır noğla, şəkərə, qəndə; Bizim evdə axta zoğal da yoxdur.* M.P.Vaqif. *İyirmi-otuz adam qız evində yeyib-içib, hərə cib yaylığına yarım girvənkə noğul, şirni, konfet, qənd bağlayıb götürüb gedirlər*. R.Əfəndiyev.

**NOĞULDAN** *is.* Kiçik taxça. ..*Qız evində qıza cehiz üçün .. taxçalara, noğuldanlara, buxarıya əlvan pərdələr tikəcəklər*. R.Əfəndiyev.

**NOHUR** *is.* Güclü yağışdan, seldən sonra su yığılmış çökək gölməçə yer. *Küçələr palçıq, səkilərin qabağı nohur olurdu.* H.Sarabski. // Göl, gölcük.

**NOXTA** *is.* Minik heyvanlarının başına salınan kəndir, qayış və s. *At almamış noxta davası edir.* (Ata. sözü). *Əmiraslan Nurəddini ata mindirib noxtanın ucundan yapışdı*. S.S.Axundov. *Nisə xala gəlib noxtadan yapışdı və darvazaya tərəf yönəldi.* Qantəmir.

◊ **Noxtasını tutmaq (çəkmək dartmaq, vermək)** *dan. kob*. – birini daim tabeliyində, əlində saxlamaq. [Molla Vəli Hacı Novruza:] *İndi gördün ki, mən hər şeydən baxəbərəm? Camaatın noxtasını verəcəklər kor İsrafilin oğlu kimi it-qurdun əlinə...* Ə.Haqverdiyev.

**NOXTALAMA** "Noxtalamaq"dan *f.is.*

**NOXTALAMAQ** *f.* 1. Heyvanın başına noxta vurmaq, noxta salmaq. *Atı noxtalamaq.* – [Alo] *Yabını noxtalayıb yekə toxum xurcununun yanına çəkdi.* S.Rəhimov.

2. *məc.* Daim birini öz tabeliyində saxlamaq, özündən asılı etmək, əlində tutmaq; yüyənləmək. [Mustafa bəy:] *İndi gərək başımızı noxtalayıb verək oğul-uşaq əlinə.* Ə.Haqverdiyev. [Yasavul:] ..*Mənim bu keçəl kəlləm, əslində hər zaman* [Talıbxanı] *noxtalayıb, yedəyində hərləyibdir!* S.Rəhimov.

**NOXTALANMA** "Noxtalanmaq"dan *f.is.*

**NOXTALANMAQ** *məch.* Başına noxta salınmaq, noxta vurulmaq. *At noxtalanıb.*

**NOXUD** *is. bot.* Paxlalılar fəsiləsindən girdə dənəli birillik bostan bitkisi. *Noxud əkmək.* // Həmin bitkinin bişmişdə istifadə edilən dənələri. *Bozbaşa noxud tökmək.* ☐ **Noxud boyda (qədər)** – çox az, kiçik, cüzi şey haqqında. [Kərbəlayı:] *Əgər sizdə bir noxud qədər ağıl olaydı..* H.Nəzərli.

**NOXUDDAN** *is.* Noxud, su və azacıq ət qarışığı olan sulu xörək; noxud şorbası.

**NOXUDFALI** *is.* Noxudla açılan fal. [Qızyetər:] *Get, bir həmşəri Cahanı da çağır gəlsin. O, yaxşı noxudfalı açır.* Ə.Haqverdiyev.

**NOXUDLU** *sif.* İçərisinə noxud tökülmüş, noxudu olan. *Noxudlu dovğa. – Noxudlu bozbaşdan aldığı iri loğmalar* [Büləndin] *boğazından aşağı ötdükcə o özündə dərin bir məmnuniyyət hiss edirdi.* Ə.Əbülhəsən.

**NOXUDLUQ** *is.* 1. Noxud əkilmiş yer, sahə. *Bostanın yarısı noxudluqdur.*

2. *dan.* "Bir" sözü ilə – noxud boyda, noxud qədər. [Gülsabah:] *Qurban, sən allah, bir noxudluq da Ərdəbil cövhəri al.* M.Əliyev.

**NOXUDU** *sif.* Yaşılaçalan, sarı-boz (rəng). *Noxudu şal.*

◊ **Noxudu gülüş** – arası kəsilməyən, xırıltılı gülüş. [Salman] *güləndə elə bil ki, daşın altında qurut əzirdilər, arasıkəsilməz xırıltılar eşidilirdi. Buna elarası noxudu gülüş deyirlər.* M.İbrahimov.

**NOXUDVARİ** *sif.* Noxud kimi, noxuda oxşar. *Noxudvari muncuq.*

**NOKÁUT** *is.* [*ing.*] Boksçunun aldığı zərbə nəticəsində huşunu itirməsi. *Döyüşü nokautla uduzan boksçuya üç ay müddətində yarışlarda iştirak etmək qadağan olunur.*

**NOKDÁUN** *is.* [*ing.*] Boksçunun aldığı zərbə nəticəsində başının gicəllənməsi. *Nokdaun vəziyyətinə düşmüş boksçu hakim səkkiz sayınca özünə gəlib yarışı davam etdirmək iqtidarında olur.*

**NOKTÜRN** [*fr.*] Kiçik lirik musiqi əsəri. *Noktürn* (*fransızca* "*gecə mahnısı*" *mənasını verən sözdən götürülmüş*) *kiçik instrumental əsərdir.* Ə.Bədəlbəyli.

**NOQAY** *is.* Şimali Qafqazda yaşayan türk xalqlarından biri və həmin xalqa mənsub olan adam.

**NOLA** "Nə ola", "nə olaydı" sözünün klassik şeirdə sual məqamında işlənən ixtisar forması. *Ey Füzuli, nola gər saxlar isəm canı əziz; Vaxt ola, kim ola ol şuxi-sitəmkarə fəda.* Füzuli.

**NOM** *is.* [*yun.*] 1. Qədim Misirdə mahal, vilayət.

2. Müasir Yunanıstanda inzibati-ərazi vahidi.

**NOMÁRX** *is.* [*yun.*] Nomun hökmdarı, başçısı.

**NOMENKLATÚRA** [*lat.* nomenclatura – siyahı, adların yazılışı] 1. Hər hansı elm, incəsənət, texnika və s. sahəsində işlənən adların, terminlərin məcmusu, ümumi siyahısı. *Coğrafi nomenklatura. Tibb nomenklaturası.*

2. Müəssisə mühasibatının açdığı hesablar siyahısı.

◊ **Nomenklatur işçi** – şəxsən yuxarı təşkilat tərəfindən vəzifəyə təyin və ya təsdiq edilən işçi.

**NOMİNÁL** [*lat.* nominalis – adlı, üstündə ad yazılmış] Qiymətli kağızlarda, kağız pul nişanlarında, sikkələrdə göstərilən nominal dəyər.

**NOMİNASİYA** *is.* [*lat.*] 1. Ad, advermə.

2. Müsabiqəyə çıxarılan sahələr.

**NONÉT** *is.* [*ital.*] 1. Doqquz alət və ya səs üçün musiqi əsəri.

2. Doqquz ifaçıdan ibarət musiqi ansamblı.

**NORKA** *is.* [*rus.*] Dələlər fəsiləsindən yırtıcı məməli heyvan cinsi və onun dərisi.

**NORD** *is.* [*alm.*] Şimal.

**NÓRMA** [*lat.*] 1. Qanuna salınmış; qayda, üsul. *Hüquq normaları.* // Hamı tərəfindən qəbul edilmiş adi, məcburi qayda, nizam. *Ədəbi dil normaları. Əxlaq normaları.*

2. Müəyyən edilmiş ölçü, miqdar, orta kəmiyyət. *Normanı yerinə yetirmək. Normadan geri qalmaq.*

◊ **Normaya düşmək** – təbii, adi vəziyyət almaq, adi qaydaya düşmək.

**NORMAÇI** *is.* Normalaşdırma işi ilə məşğul olan işçi. *Normaçı əlində dəftər briqadaları gəzib qeyd götürürdü.* Mir Cəlal.

**NORMÁL** *sif.* [*lat.* normalis – düzxətli] 1. Normaya uyğun, necə lazımsa elə; təbii, adi. *Normal temperatur. Normal artım. – Zənnimcə qorxusu yoxdur, indi artıq ürəyi normal* (z.) *bir surətlə döyünməkdədir.* H.Nəzərli.

2. Ruhi cəhətdən sağlam. *Normal adam.*

**NORMALAŞDIRILMA** "Normalaşdırılmaq"dan *f.is.*

**NORMALAŞDIRILMAQ** *f.* Norma qoyulmaq, normaya tabe edilmək, hədd təyin edilmək.

**NORMALAŞDIRILMIŞ** *f.sif.* Normaya salınmış, normaya tabe edilmiş, yaxud yaxınlaşdırılmış.

**NORMALAŞDIRMA** "Normalaşdırmaq"-dan *f.is.*

**NORMALAŞDIRMAQ** *f.* Bir şey üçün norma qoymaq, norma, hədd təyin etmək; normaya tabe etmək (b a x **norma**).

**NORMALLAŞDIRILMA** "Normallaşdırılmaq"dan *f.is.*

**NORMALLAŞDIRILMAQ** *məch.* Normal hala salınmaq, qaydaya salınmaq, yoluna salınmaq (b a x **normal**).

**NORMALLAŞDIRMA** "Normallaşdırmaq"dan *f.is.*

**NORMALLAŞDIRMAQ** *f.* Normal hala salmaq, qaydaya salmaq, adi hala salmaq (b a x **normal**).

**NORMALLAŞMA** "Normallaşmaq"dan *f.is.*

**NORMALLAŞMAQ** *f.* Normal hala (qaydaya) düşmək, adi halına düşmək. *Vəziyyət normallaşmışdır.*

**NORMANLAR** *cəm* VIII-XI əsrlərdə Avropa ölkələrinə basqınlar etmiş şimali german tayfaları.

**NORMATÍV** [*lat.* normatio – qaydaya salma] 1. Hər hansı bir işin görülməsi, icrası üçün əsas götürülən normalar göstəricisi. *Plan normativi. Texniki normativlər.*

2. Hər hansı bir şey üçün norma müəyyənləşdirən, norma qoyan. *Normativ qrammatika. Məktəb normativləri.*

**NORVEÇ** *is.* Skandinaviya ölkələrindən və xalqlarından birinin adı.

**NOSTALGİYA** *is.* [*yun.*] Xiffət, həsrət, qüssə.

**NOT** [*lat.* nota – qeyd, işarə] 1. Hər hansı musiqi səsinin şərti qrafik işarəsi. *Bas notu.*

2. Musiqi və ya mahnıda səsin özü. *Oxuduqda səsinin hər notunu gözləmək.*

3. Qrafik işarələrlə yazılmış musiqi əsərlərinin mətni; belə mətnlərdən ibarət dəftər, kitab və s. *Not üzrə çalmaq. Not papkası. – Güllər .. not dəftərinə baxdı.* İ.Əfəndiyev. *Səbri tələsmədən not vərəqini çevirdi və gözlərini məchul bir nöqtəyə zilləyib yenə çalmağa başladı.* M.Hüseyn.

**NÓTA** [*lat.* nota – işarə, məzəmmət, məktub] Bir hökumətin başqa hökumətə rəsmi yazılı diplomatik müraciəti. *Etiraz notası. Nota mübadiləsi.* – [Əbülhəsən bəy:] *Ona təşəkkür etdim, sonra da qız Amerika konsuluna verilən notanı oxudu.* M.S.Ordubadi.

**NOTARİÁL** *sif.* [*lat.*] Notariusa, hüquqi aktların, sənədlərin və onların surətlərindəki imzaların doğruluğunu və s. təsdiq etmək məsələsilə əlaqədar olan. *Notarial kontor. Notarial surət.*

**NOTARİÚS** [*lat.* notarius – mirzə, katib] 1. Müxtəlif sənədləri, hüquqi aktları təsdiq etmək vəzifəsi daşıyan rəsmi şəxs. [Kərbəlayı Qubad:] *..Bəy, olmazmı ki, bu işi notarius əli ilə eyliyək.* Ü.Hacıbəyov. *Oğlan durub, sandıqdan notarius tərəfindən möhürlənmiş bir kağız çıxarıb müsafirin qabağına qoydu.* Ə.Haqverdiyev.

2. Notarius idarəsi, kontoru. *Notariusa getmək. Notariusda sənədləri təsdiq elətdirmək. – Aslan bəyin əlində notariusdan verilmiş kağız vardır.* A.Şaiq.

**NOTLU** *sif.* Notla ifa edən, notla çalan. *Notlu orkestr. – Azərbaycanda yeni operanın yaranması ilə bir zamanda dördsəsli xor, notlu orkestr, nota yazılmış muğamlar meydana gəlmişdir.* Ü.Hacıbəyov.

**NOTSUZ** *sif.* və *zərf* Notu olmayan, notla ifa edilməyən. *Notsuz musiqiçilər dəstəsi. Notsuz çalmaq.*

**NOV** *is.* Su və s. axıtmaq üçün dəmirdən, ağacdan, daşdan və s.-dən yarımdairə şəklində düzəldilmiş axıntı yolu, su yolu; arx, kanal. *Ağac nov. Saxsı nov.* – [Qurban:] *Onu dəyirmanın novundan salsan donuzluğundan diri çıxar.* Ə.Haqverdiyev. *Daxmanın qırıq novu da çoxdan su görmür, daş, torpaqla dolmuşdur.* Mir Cəlal.

**NOVÁTOR** [*lat.* novator – yenilik yaradan] Hər hansı bir fəaliyyət sahəsində yeni, mütərəqqi fikirlər, prinsiplər, üsullar irəli sürən və həyata keçirən adam; yenilikçi. *Novator şair. İstehsalat novatoru. – Alim və novatorlarımız .. məhsuldarlığı daha da artırmaq yollarını axtarırlar.* M.İbrahimov.

**NOVATORLUQ** *is.* Novatorun fəaliyyəti; yenilikçilik; yenilik. *Novatorluq deyəndə, biz Sabirin, Molla Nəsrəddinin, habelə bu gün şerimizin ideya istiqamətini müəyyən edən .. ənənələrdən öyrənmək məsələsini irəli sürməliyik.* R.Rza. [Xəlilov:] *Özgə vaxt cəsarətdən, novatorluqdan dəm vurursunuz.* M.Hüseyn.

**NOVBAHAR** *is.* [*fars.*] *klas.* Yazın əvvəli. *Novbahar olsun, gül olsun, arədə xar olmasun.* Nəsimi. *Ey əndəlib, səndə bu nə qanundur; Fəğan çəkmək novbaharı görəndə.* Q.Zakir.

2. *məc.* Gənclik, cavanlıq mənasında. *Ömrünün gülzarı xəzanə dönüb; Novbaharı gedən bəs ağlamazmı?* M.V.Vidadi.

**NOVBAR** *sif.* [*fars.*] 1. İlk yetişən meyvə; birinci, təzə meyvə. *Novbar üzüm. Novbar yemiş.* – [Yaylıq üzüm] *tez yetişdiyinə görə novbar olur, çox sevilir, az tapılır, baha satılır.* Mir Cəlal.

2. *məc.* İlk övlad mənasında. [Ananın] *ömrünün novbarı, bəxtinin çiçəyi, evinin dirəyi, igid oğlu Buğac ilk dəfə idi ki, atası ilə ova çıxmışdı.* M.Rzaquluzadə.

**NOVCUQ** *is.* Balaca nov.

**NOVÇA** *is.* Balaca nov. *Qar şiddətlə əriyirdi, novçalar şırhaşır axırdı.* Ə.Əbülhəsən. *Qoşabulağın suyu axıb novçaya töküldükcə selin qabağınca gələn daşların şaqqıltısını xatırladırdı.* S.Rəhman.

**NOVDAN** *is.* [*fars.*] b a x **novça**. *Əriyən qarın axıb getdiyini, novdanlardan suyun töküldüyünü gördükcə yaz yada düşürdü.* Mir Cəlal. *Novdanları yağış döyür .. pəncərəmi yel qırır; Bir qapının arxasında körpə uşaq hıçqırır.* Ə.Cəmil. // b a x **nov**.

**NOVÉLLA** [*ital.*] *ədəb.* Qısa, kiçik hekayə. "*Poçt qutusu*" *bədii forması, yazılışı və süjetin yığcamlığı, mənalılığı və şirinliyi etibarı ilə dünya ədəbiyyatının ən yaxşı novellaları ilə bir cərgədə durur.* M.İbrahimov.

**NOVELLAÇI, NOVELLAYAZAN** *is.* Novella yazan yazıçı, novella müəllifi.

**NOVLU** *sif.* Novu olan.

**NOVOKAİN** [*lat.* novus – yeni və (ko)kain] Keyləşdirmə və başqa müalicə məqsədləri üçün işlədilən tibbi preparat.

**NOVRUZ** *is.* [*fars.* yeni gün] Baharın girdiyi ilk gün (martın 22-nə uyğun gəlir). *Hər gün açır könlümü zövqi-visalın yengidən; Gərçi güllər açmağa hər ildə bir novruz olur.* Füzuli. // Həmin gün edilən bayram. *Ax, gözəl bayram, ax gözəl novruz! Ax min-min balaca uşaqların qəlblərini şad edən novruz!* C.Məmmədquluzadə. *Novruz bayramında qız üçün bayram xələti, novbar meyvə, yemiş alıb göndərərdilər.* H.Sarabski.

**NOVRUZGÜLÜ** *is.* İlk baharda açılan sarı çiçəkli ətirli gül. *Dağlar, çöllər dişərdi; Novruzgülü göyərdi.* A.Səhhət. *Salamladıq bülbülü; Açıldı novruzgülü.* M.Dilbazi.

**NOVRUZQABAĞI** *zərf* Novruzdan əvvəlki günlər, novruza bir neçə gün qalmış, novruz ərəfəsi. [Nişanlı qıza] *novruzqabağı çərşənbə yemişi, novruz bayramında tel, paxlava .. və s. həlviyyat xonçası, üstə bir əlbəsəlik ipək parça labüd gedəcəkdir.* R.Əfəndiyev. *Novruzqabağı idi. Bağışlanmaqdan danışırdılar.* Mir Cəlal.

**NOYÁBR** [*lat.*] Təqvim ilinin on birinci ayı.

**NÖKƏR** *is.* Keçmişdə ağasına xidmət edən və onun şəxsi tapşırıqlarını yerinə yetirən ev xidmətçisi (oğlan). [Əhməd tacirbaşı] *özü sərkarını, sarbanını, bir də nökərlərini, gözəgələn igidlərini götürüb çıxdı bir uca təpənin başına.* "Koroğlu". *Nökər içəri daxil olub, Bahadıra: – Bir şəxs sizi görmək istəyir, – dedi.* N.Nərimanov. // *nifr.* Başqasına qulluq göstərən, yaltaqlıq edən adam haqqında.

**NÖKƏRÇƏ** *is.* Balaca nökər, nökərçilik edən balaca oğlan uşağı. [Qoca:] *Nökərçəmiz bir cam buğlana-buğlana bişmiş süd gətirdi.* A.Divanbəyoğlu.

**NÖKƏRÇİLİK** *is.* Nökər olma, nökərlik etmə. *Nökərçilik etmə.* – [Rəhim Leylaya:] *Mən atamı, anamı unudub bu qapıda səndən ötrü nökərçiliyi qəbul eyləmişəm.* N.Vəzirov. *Bəxtiyar bütün ömrünü özgələrin qapısında nökərçiliklə keçirdiyindən nə dünya, nə də axirət işlərindən bir xəbəri olmuşdu.* S.Hüseyn. // *məc.* Yaltaqlanma, xidmət göstərmə, özünü nökər kimi aparma.

**NÖKƏRLİK** *is.* Nökərin işi, vəzifəsi; nökərçilik.

**NÖQSAN** *is.* [*ər.*] 1. Çatışmayan cəhət, çatışmazlıq. *Nöqsanları aradan qaldırmaq.* – *Nöqsana göz yummaq onun ömrünü uzatmaq deməkdir.* M.İbrahimov.

2. Qüsur, qəbahət, eyib, naqislik. *Onun nöqsanı nədədir? – İndi sənin özün təsəvvür et, öz nöqsanını qarşına qoyub sənə tapşırılan vəzifə ilə müqayisə et?* M.S.Ordubadi. [İskəndər:] *Dişi, erkək bir candır; Bunlara tək yaşamaq nöqsandır.* A.Şaiq.

3. *dan.* Qeyri-kamillik, eyib, zədə. *Bu malın nöqsanı var.*

**NÖQSANLI** *sif.* 1. Nöqsanı olan, qüsurlu, eyibli, kəsirli, səhvli. *Nöqsanlı kitab. Nöqsanlı yazı. – Şagirdlərin yazı nitqləri çox nöqsanlıdır.* M.İbrahimov.

2. Qeyri-kamil, eyibli, zədəli, çatışmayan cəhəti olan. *Nöqsanlı mal.*

**NÖQSANLILIQ** *is.* Nöqsanlı şeyin halı, qeyri-kamillik.

**NÖQSANSIZ** *sif.* Heç bir nöqsanı, eybi, kəsiri olmayan; kəsirsiz, qüsursuz. *Nöqsansız iş. Nöqsansız yazı.*

**NÖQSANSIZLIQ** *is.* Nöqsansız şeyin halı; qüsursuzluq, kəsirsizlik.

**NÖQTEYİ-NƏZƏR** *is.* [*ər.*] Müəyyən bir məsələ haqqında fikir, görüş, mülahizə, baxış; baxım. ◻ **Bu nöqteyi-nəzərdən** – bu baxımdan. ...**nöqteyi-nəzərindən** – ..baxımından. *Hüquqi nöqteyi-nəzərdən bu sənəd saxtadır.* Çəmənzəminli.

**NÖQTƏ** *is.* 1. Qələm, karandaş, iynə və s. bu kimi şeylərin ucunun bir yerə batmasından, ya toxunmasından qalan girdə xalcıq, iz, ləkə. *Nöqtələr şəklində güllər vurmaq. Xətt nöqtələrdən ibarətdir.* // *məc.* Zorla seçilə bilən, nöqtəyə oxşayan kiçik şey haqqında. [Dərviş:] *Ağartının ortasında bir qara nöqtə gördüm, qoca kişi yüyürdü, oradan bağırdı.* A.Divanbəyoğlu. *Birdən hər təyyarədən bir-iki nöqtə ayrılıb ağır-ağır yerə enməyə başladı.* M.Rzaquluzadə. ◻ **Nöqtə kimi** – çox kiçik, güclə seçilə bilən. *Evlər uzaqda nöqtə kimi qaralırdı. – Mələyə elə gəldi ki, arvadın gözünün ağı həddindən artıq böyüyüb, qarası isə tən ortada, balaca bir nöqtə kimi işıldayır.* İ.Şıxlı.

2. *qram.* Cümləni ayıran, həmçinin sözləri ixtisar şəklində yazdıqda (və i.a. və s.) qoyulan durğu işarəsi (.). // Ərəb əlifbasında bəzi hərflərin altına, ya üstünə qoyulan kiçik işarə (məs.: ب ن).

3. Riyaziyyatın, habelə mexanika və fizikanın əsas anlayışı; ölçüsü olmayan yer, xətt kəsiyinin hüdudu. *Xətlərin kəsişdiyi nöqtə. Dayaq nöqtəsi. – Çox kiçik cismin hərəkətinin öyrənilməsinin asanlığı bundan ibarətdir ki, onun ayrı-ayrı nöqtələrinin hərəkətləri bir-birindən çox az fərqlənir.* Z.Xəlilov.

4. Fəzada və ya bir şeyin üzərində müəyyən yer. *Dağ silsiləsinin ən uca nöqtəsi.*

5. Bir iş görülən, ya bir şeyin yerləşdiyi yer, məntəqə. *Ticarət nöqtəsi* (mağaza və s.). *Atəş nöqtəsi* (pulemyot, top və s.). – *Fişəng atılanda Fərhad düşmənin atəş nöqtəsini gördü.* Ə.Vəliyev. // Mövqe, yer. *Bir nöqtəyə yığılmaq* (*cəm olmaq*). *O nöqtəyə çatan kimi durduq.*

6. Yer, cəhət, səmt. *Dünyanın heç bir nöqtəsində, heç bir tayfa arasında şeytan o qədər modda deyil ki, biz müsəlmanların arasındadır.* C.Məmmədquluzadə. [Biz] *..aləmi-islamın bəzi nöqtələrində müşahidə olunan tərəqqiləri görüb şad olduq.* F.Köçərli. // "Bir" sözü ilə yenə müəyyən yer bildirir. *Bir nöqtəyə baxmaq. Bir nöqtədə durmaq. – Yoldaşlar nəzərlərini bir nöqtəyə dikib, dərin bir xəyala dalmışdılar.* H.Nəzərli.

7. Məc. mənada tərkiblərdə: **qəlbinin incə nöqtəsi, ruhunun həssas nöqtəsi** və s. şəklində işlənir. *Telli ixtiyarsız bir ah çəkdi. Müəllim onun ruhunun ən həssas nöqtəsinə toxunmuşdu.* S.Hüseyn. [Qüdrət] *adamların əhvali-ruhiyyəsindəki zəif nöqtələrin .. gizli qaldığına təəssüf edib, Fikrətin sözünü yarıda kəsdiyinə peşman oldu.* M.Hüseyn.

8. *fiz.* Hər hansı maddənin bir haldan (aqreqat vəziyyətindən) başqa hala keçməsini göstərən temperatur həddi. *Qaynama nöqtəsi. Donma nöqtəsi.*

9. *mus.* Hədd, dərəcə. "*Simayi-şəms*" *bütün əsərin* (*şurun*) *ən yüksək nöqtəsidir.* Ü.Hacıbəyov.

◊ **Nöqtə qoymaq** – bitirmək, qurtarmaq, tamamlamaq, axıra çatdırmaq. *Burada nöqtə qoy! – Gözlərindən axan yaş; Onun hicran kitabına nöqtə qoydu, qapandı.* B.Vahabzadə.

**NÖQTƏBƏNÖQTƏ** *zərf* [*ər.* nöqtə və *fars.* ...bə...] Tamamilə, olduğu kimi, eynən, heç bir kəlmə buraxmadan, kəlməsi-kəlməsinə,

sözbəsöz, bütün təfərrüatı ilə. *Nöqtəbənöqtə danışmaq. Nöqtəbənöqtə yazıb vermək. – Yazılsa nöqtəbənöqtə, deyilsə hərfbəhərf; Qurtarmaz həşrə qədər halü-macərası gülün*. X.Natəvan. [Bəy:] *O da bizə məlumdur ki, mərhumun adı bu saat qubernatorun hüzurunda nöqtəbənöqtə yazılıbdır.* Mir Cəlal.

**NÖQTƏCƏ** *zərf* Son dərəcə az, olduqca az; zərrəcə. *Dəhənin sirrini sordum, dedi, yoxdan nə deyim; Seyyidin nöqtəcə yox əqli, nə nadan görünür*. S.Ə.Şirvani.

**NÖQTƏLƏMƏ** "Nöqtələmək"dən *f. is.*

**NÖQTƏLƏMƏK** *f.* Nöqtə və ya nöqtələr qoymaq, nöqtə düzmək.

**NÖQTƏSİ-NÖQTƏSİNƏ** b a x **nöqtəbənöqtə**.

**NÖMRƏ** [*lat.* numerus – ədəd] 1. Bir şeyin eyni cinsli şeylər sırasında sıra sayı. *Evin nömrəsi. İnventar nömrəsi. Biletin nömrəsi.*

2. Üzərində sıra nömrəsi yazılmış (pətə, kağız parçası və s.) hər hansı bir şeyin, xüsusən, paltarın, ayaqqabının və s.-nin ölçüsünü göstərən rəqəm. *21 nömrəli corab. 50 nömrəli palto. 5 nömrəli əlcək.*

3. Sıra nömrəsi ilə göstərilmiş hər hansı bir şey. *Məcmuənin mart nömrəsi. Qəzetin növbəti nömrəsi. – Məlum oldu ki, biz doqquz ayın müddətində otuz doqquz nömrə* "*Molla Nəsrəddin*" *jurnalı yazmışıq*. C.Məmmədquluzadə.

4. Mehmanxanada, hamamda və s.-də ayrı-ayrı otaqlar. *Axırda dedilər ki, hamamların birində nömrələr var*. Ə.Haqverdiyev. *Otel sahibi və onun dalısınca bir əcnəbi nömrəyə girdilər*. S.M.Qənizadə.

5. Hər hansı bir tamaşanın, konsertin və s.-nin tərkib hissələrindən hər biri. *Konsertin sirk nömrəsi başlandı. – Diktor qocaman ifaçının adını xüsusi bir məhəbbətlə çəkərək konsertin növbəti nömrəsini elan edir*. Ə.Bədəlbəyli.

6. *məc. dan.* Gözlənilməz qəribə hərəkət, iş, oyun, hoqqa; kələk. *Onun bu nömrəsi keçmədi. – ..Yox balam, deyəsən, nömrəynən bunu başa vermək olmayacaq*. Ə.Əbülhəsən. [Şahin:] *Mənim orijinal bir nömrəm var, o da kasa rəqsidir. Kasaları su ilə doldurub bir podnosa düzürəm və başıma qoyub rəqs eləyirəm*. S.Rəhman.

◊ **Nömrə gəlmək** – aldatmaq, hiylə işlətmək, kələk gəlmək. *Yoldaşına nömrə gəlmək.*

**NÖMRƏBAZ** *sif.* [*lat.* numerus və *fars.* ...baz] *dan.* Hiyləgər, fırıldaqçı, kələkbaz. *Nömrəbaz adam*.

**NÖMRƏLƏMƏ** "Nömrələmək"dən *f.is.*

**NÖMRƏLƏMƏK** *f.* Şeylərə sıra üzrə rəqəm yazmaq, nömrə qoymaq. *Kitabları nömrələmək. Yerləri nömrələmək* (teatrda, kinoda və s.-də).

**NÖMRƏLƏNMƏK** *məch.* Nömrə yazılmaq, nömrə qoyulmaq. *Qapılar nömrələnib.*

**NÖMRƏLƏNMİŞ** *f.sif.* Nömrə yazılmış, nömrə vurulmuş. *Nömrələnmiş sənədlər. Nömrələnmiş yerlər*.

**NÖMRƏLİ** *sif.* Nömrəsi olan, nömrə yazılmış, nömrə vurulmuş. *Nömrəli qapı. Nömrəli maşın. – Qarı daima beş nömrəli yumşaq vaqona minərdi..* Ə.Əbülhəsən.

**NÖMRƏSİZ** *sif.* Nömrəsi olmayan, nömrə vurulmamış, nömrə qoyulmamış. *Nömrəsiz otaq. Nömrəsiz siyahı. – Nömrəsiz kamera bu hay-küydən uzaq idi.* Mir Cəlal.

**NÖŞ** "Nöşün" sözünün canlı dildə işlənən ixtisar forması. *Söz sözə mehribandı; Qaş gözə mehribandı; O ki düşmənə dostdu; Nöş bizə mehribandı?* (Bayatı). [Pirəli:] *Nöş mən gecəbəgündüz özümü oda, alova atıram?* M.Hüseyn.

**NÖŞÜN** "Nə üçün" sözünün canlı dildə işlənən təhrif edilmiş forması. *Ey gözüm, nə dəyib kövrək könlünə? Ey şirin güftarım, nöşün ağladın?* M.P.Vaqif. [Məşədi Püstə bacı:] *Ay Xeyransa bacı, İnayəti nöşün evləndirmirsən?* H.Sarabski.

**NÖV** *is.* [*ər.*] 1. Dürlü, cür, təhər, çeşid. *Bu növ şey görməmişəm. – Zəmani-hicrdə gah ağlayıb, gah gülürəm; Bu eşq aləminin özgə növ haləti var*. S.Ə.Şirvani. □ **Bir növ** – birtəhər, nə yaxşı, nə pis, orta, babat. [Məcid:] *..Bir növ dolanırıq.* N.Vəzirov. [Molla Cümə:] *Məhərrəmlik gəlincəyədək gərək bir növ dolanaq*. Ə.Haqverdiyev. **Bu növ** – bu qaydada, bu cür, bu üsulda. *İslam uşağı yatsın ayağında falaqqa; Bu növ idi təlim; Vursun buların başına həm mirzə taraqqa.* M.Ə.Sabir. **O növ (ilə)** – o cür, o təhər, o qaydada, elə. *Nə gərəkdir bizə o növ söhbətlər; Eşidiz pəndlər, nəsihətlər*. S.Ə.Şirvani. *Nifrət edib cümlə*

*qaçırdı ondan; O növ ilə ki, qaçarlar taundan.* A.Səhhət.

2. *biol.* Sistematikada: cinsin tərkibinə daxil olan və öz əsasından kəskin əlamətlərlə fərqlənməyən ayrıca qrup. *Balığın növləri. Quş növləri. – Kəndin aşağısında tez-yetişən qırmızı alma növləri var.* S.Rəhman. *Yaylaqlardan ən yaxşı, ən çox çiçək, böcək növlərini* [Bahar] *toplayardı.* B.Bayramov.

3. Bir şeyin başqa bir şəkli, variantı, tipi. *Yeni təlim növü.*

4. *qram.* Feildə: hərəkətin icrasının səciyyəsini göstərən qrammatik kateqoriya. *Məlum növ. Məchul növ.*

◊ **Növi-bəşər** *köhn.* – insan nəsli, inan cinsi, insanlar. **Bəni-növi-bəşər** – b a x **bəniadəm** (“**bəni**”də). [Taybuynuz öküz] *həm öz cinslərinin və həm də bəni-növi-bəşərin nəzərində hörmətdən düşübdür.* F.Köçərli.

**NÖVARASI** *sif. biol.* Müxtəlif bitki və ya heyvan növləri arasında əmələ gələn. *Növarası cütləşmə.*

**NÖVBƏ** *is.* [*ər.*] 1. Hər hansı bir işin icrasında ardıcıllıq, sıra qaydası. *Məsələləri növbəyə qoymaq. Növbəyə riayət etmək.* ☐ **Birinci (ilk) növbədə** – hər şeydən əvvəl, hamıdan qabaq. *Tresti kəsirdən qurtarmaq üçün birinci növbədə müşavirə və nitqləri ixtisara salmaq lazımdır.* M.Hüseyn.

2. Bu qaydada (bir-birinin ardınca) duraraq bir şey gözləyən adamlar sırası. *Bilet üçün növbə. Kino kassasında böyük növbə var. – Ağa, səbr elə, hələ vaxta var və bizə növbə yetişməmiş bilet verməzlər.* Ə.Haqverdiyev. ☐ **Növbəyə durmaq** – bir şey üçün biri digərinin arxasında cərgə ilə durmaq. *Şairləri salamlamaq üçün qızlar, gəlinlər bir-birinin dalınca cərgə ilə növbəyə durmuşdu.* M.S.Ordubadi. // Bu sırada tutulan yer. *Növbəsini başqasına vermək. Növbədən çıxmaq. Növbə kimindir?*

3. İşləyən, oxuyan, istirahət edən bir qrup adamın digər qrupu əvəz etdiyi zaman, vaxt. *Onlardan Sitarə birinci növbədə, Mehparə ikinci növbədə məktəbə gedirdi.* S.Rəhimov. [Dostlar] *indicə növbədən çıxıb istirahət etməyə gedirdilər.* M.Rzaquluzadə.

4. Keşik, qarovul. *Növbə çəkmək. Növbədə olmaq. – Böyük Vətən müharibəsi günlərində kəndin cavanları* [Qaratəpədə] *növbə çəkib Arazın o tayını gözlədilər.* Ə.Vəliyev. [Fərhad:] *Bizim qoca bir həftədir hər gecə dənizdə növbə çəkir.* Ə.Məmmədxanlı.

5. Hər hansı bir xəstəliyin müəyyən vaxtlarda özünü göstərməsi və ya güclənməsi.

6. “İlə” qoşması ilə yenə sıra, ardıcıllıq bildirir. *Növbə ilə içəri girmək. Növbə ilə şagirdləri dindirmək. – Şəhərdə bir neçə şirin quyu vardı ki, buna da keşikçi qoyulmuşdu, növbə ilə xalqa su paylanırdı.* Çəmənzəminli.

**NÖVBƏDƏNKƏNAR** *sif.* Növbədə nəzərdə tutulmayan, vaxtı, müddəti qabaqcadan müəyyən olmayan.

**NÖVBƏLƏNMƏ** “Növbələnmək”dən *f.is.*

**NÖVBƏLƏNMƏK** b a x **növbələşmək**.

**NÖVBƏLƏŞMƏ** “Növbələşmək”dən *f.is.*

**NÖVBƏLƏŞMƏK** *f.* Növbə ilə biri digərini əvəz etmək, ardıcıl dəyişilmək, bir-birinin ardınca gəlmək. *Dastan şeirlə nəsrin növbələşməsi prinsipinə əsaslanır.*

**NÖVBƏLİ** *sif.* Növbə ilə olan, növbəyə əsaslanan. ☐ **Növbəli əkin** – əkinçilikdə: dənli bitkilərin, otların ardıcıl surətdə əvəzlənməsi üsulu.

**NÖVBƏNÖV** *sif.* Cürbəcür, hər cür, müxtəlif. *Süfrədə növbənöv yeməklər var. Onun növbənöv paltarları var. – Hacının sərvəti haqqında növbənöv hekayələr söylənirdi və onun banklarda olan pulunun qədərini milyon hesab edirdilər.* Ə.Haqverdiyev.

**NÖVBƏSİZ** *zərf* Növbə gözləmədən, növbədənxaric, növbədənkənar. *Növbəsiz içəri girmək. Növbəsiz bilet almaq.*

**NÖVBƏT** b a x **növbə**. *Bir gün növbət Mirzəyə gəlmişdi.* Ə.Haqverdiyev. *..Gəlinlər bir-bir oynadılar, göyçək qızlar süzdülər, növbət gəlinə gəldi.* Çəmənzəminli.

**NÖVBƏTÇİ** *is.* 1. Növbədə durub qarovul çəkən; keşikçi, qarovulçu. *Növbətçi postu. – Sarxan dəmiryol stansiyası növbətçisinin evindən çıxıb aşağı endi.* M.Hüseyn. *Təpənin lap üstünə çatarkən növbətçidən bir əsər görmədi.* H.Nəzərli.

2. *sif.* Növbə ilə hər hansı bir xidməti vəzifəni yerinə yetirən. *Növbətçi həkim. Növbətçi müəllim. Növbətçi əsgər. – ..Əvvəl növbətçi əsgər; Bir qədər heyrət edir.* R.Rza. // İs. mənasında. *Keçirdiyi həyəcanı növbətçiyə*

*sezdirməmək üçün jiletinin cibindən zəncirli saatını çıxardıb baxdı və astaca addımlarla dəhlizə yaxınlaşdı.* İ.Şxlı.

**NÖVBƏTÇİLİK** *is.* 1. Növbədə olma, növbədə durma. *Növbətçiliyini bitirmək.*

2. Növbətçinin vəzifəsi, işi.

**NÖVBƏTİ** *sif.* [*ər.*] 1. Növbədə olan, növbə üzrə, birinci, ən yaxın olan. *Növbəti məsələ. Növbəti vəzifə. – Diktor, qocaman ifaçının adını xüsusi bir məhəbbətlə çəkərək konsertin növbəti nömrəsini elan edir.* Ə.Bəbəlbəyli.

2. Müəyyən edilmiş vaxtda ardıcıl olaraq baş verən, müəyyən ardıcıllıqla olan, növbə üzrə icra edilən, sıra ilə gedən. *Növbəti məzuniyyət. Məcmuənin növbəti nömrəsi. Növbəti çağırış. – Ulduzun həyatındakı bu qəribə gecədən üç gün sonra, o, növbəti döyüşçünü atəş altından çıxararkən birdən onun qolları sustaldı.* Ə.Məmmədxanlı. *Növbəti məşğələlərdən biri idi.* Ə.Vəliyev.

3. *dan.* Vaxtbavaxt baş verən, meydana çıxan (iş, hərəkət). *Bu onun növbəti oyunlarından biridir.*

**NÖVCAVAN** *sif.* və *is.* [*fars.*] Yeniyetmə, gənc. *Ölüm həqdir, əmma növcavan ölmək nə müşküldür.* M.V.Vidadi. *Gözlərindi nərgis, qaşlarındı yay; Heç növcavan ola bilməz sənə tay.* Q.Zakir.

**NÖVHƏ** *is.* [*ər.*] Hava ilə ölüyə oxunan hüznlü şeir, matəm nəğməsi; mərsiyə. *Növhə başlandı. – Hüseynəli sinəsini açıb başladı növhənin havası ilə şart-şart sinəsinə çırpmağa.* Ə.Haqverdiyev.

**NÖVHƏXAN** *is.* [*ər.* növhə və *fars.* ...xan] Növhə oxuyan, növhə deyən: mərsiyəxan. *Məşədi Kazım ağa minbərin dibində növhə və fərd oxumaq üçün Təbrizin gözəl səsli gənc növhəxanlarını dəvət etmişdi.* M.S.Ordubadi.

**NÖVHƏXANLIQ** *is.* Növhəxanın işi, peşəsi; mərsiyəxanlıq. *Hacılar cümlə növhəxanlıqda; Məşədilərsə canfəşanlıqda.* M.S.Ordubadi.

**NÖVLƏŞDİRİLMƏ** "Növləşdirilmək"dən *f.is.*

**NÖVLƏŞDİRİLMƏK** *məch.* Növlərə ayrılmaq, növlər üzrə seçilmək.

**NÖVLƏŞDİRMƏ** "Növləşdirmək"dən *f.is.*

**NÖVLƏŞDİRMƏK** *f.* Növlərə ayırmaq. *Taxılı növləşdirmək.*

**NÖV-NÖV** b a x **növbənöv**. *Xülasə, qalan yüz on beş kağız da bu məzmunda növ-növ iftira və yalan!* C.Məmmədquluzadə. *Kitab da növ-növdür insanlar kimi; Bədsifət, acıdil olur bir çoxu.* S.Vurğun.

**NÖVRAQ** *is.* [*ər.* "rövnəq" sözünün təhrif forması] Bəzək, yaraşıq, lətafət, gözəllik, parlaqlıq. *Qar tutub Şah dağını; Don vurub növrağını; Çəkilib tülək tərlan; Sar alıb ovlağını.* (Bayatı). // Məc. mənada. *Gül büsatı, gül əndamı, gül üzü; Mənim üçün hər növrağı şirindir.* Aşıq Ələsgər.

◊ **Növraq dönmək** – zəmanə dəyişmək, əvvəlki işlərdən iz qalmamaq. [Qarı:] *Növraq gör necə dönüb, a qız, qədim əyyamlarda çapqınçılığa, özü də harda, çöldə, kənd-kəsəkdə gecə çıxardılar.* Ə.Əbülhəsən.

**NÖVRƏS** *sif.* [*fars.*] 1. Yeni yetişmiş, təzə, novbar. *Növrəs meyvə.*

2. B a x **növrəstə**. *Dəhr vəqf etmiş məni növrəs cavanlar eşqinə.* Füzuli.

**NÖVRƏSİDƏ** [*fars.*] 1. B a x **növrəstə**. *Növrəsidə, on üç, on dörd yaşında; Eyb olmaya kirpiyində, qaşında.* M.P.Vaqif. *Məgər heç düşünməz qəbahətini? Gedib növrəsidə cəvanə sevər.* Q.Zakir.

**NÖVRƏSTƏ** *sif.* [*fars.*] Həddi-büluğa yetmiş, cavan, gənc. *Növrəstə qız. Növrəstə oğlan. – Onda görürsən yıxılıb yanbayan; Bir neçə növrəstə cavan laybalay.* M.Ə.Sabir. [İskəndər bəy:] *Xala, sən nə diribaş qarısan? Mənə nə verərsən, sənə bir elə dava verim ki, növrəstə cavan olasan?* N.Vəzirov.

**NÖYÜT** *is. dan.* b a x **neft**. [Qaçay:] *Üç gündür Mirzə Cəmil nöyüt vermir, stansiyada da tapmırıq.* Ə.Vəliyev.

**NUBİYALI** *is.* Nil çayı (Afrika) sahillərində yaşayan xalq və həmin xalqa mənsub olan adam.

**NUH** *is.* [*ər.*] Peyğəmbərlərdən birinin adı. *Nuhun gəmisi.*

**NUQA** *is.* [*fr.*] Şəkər və qozdan hazırlanmış şirniyyat növü; qənnadı məmulatı.

**NUMİZMÁTİK** [*latıncadan*] Numizmatika mütəxəssisi; qədim sikkələri və medalları yığan və tədqiq edən alim.

**NUMİZMÁTİKA** [*lat.* numisma – pul] Qədim sikkə və medalları toplayıb tədqiq edən elm. [Səməndər:] *İsi dayı, siz özünüz*

*numizmatikadan yaxşı baş çıxarırsınız.* B.Bayramov.

**NUN** *is.* [*ər.*] Ərəb əlifbasında "ن" şəklində yazılan hərfin adı. // *məc.* Klassik şeirdə gözəlin qaşları bu hərfə – qövsə oxşadılır. *Qaşın bir nundur, çəkmiş qəza qüdrətdən.* M.V.Vidadi.

◊ **Qəddi nun olmaq** – b a x **qəddi bükülmək** ("**qədd**"də).

**NUR** *is.* [*ər.*] 1. Aydınlıq, işıq. *Günəşin nuru ətrafı işıqlandırmışdır. – Yaz mövsümü endikcə səmadan yerə axşam; Gün nuru verir dağlara min rəngi-dilara.* A.Səhhət. *Çıxdı günəş, doldu cahan nur ilə; Cütçü sürür tarlada cüt şur ilə.* M.Ə.Sabir. *Göy üzü damar-damar; Göydən yerə nur damar.* (Bayatı). □ **Nur almaq** – b a x **nurlanmaq**. **Nur saçmaq (səpmək, tökmək)** – işıq vermək, işıqlatmaq, ziya saçmaq, parlatmaq. *Gecəki yağışdan çiçəklərin, yarpaqların uclarından sallanan damlalar .. parıl-parıl parıldayır, ətrafına incə telli nurlar saçırdı.* A.Şaiq. *Göyün altun saçlı qızı nur saçar; İnsanların tutqun könlünü açar.* H.Cavid. **Nura boyamaq (qərq etmək)** – işıqlandırmaq, işıq saçmaq, parlatmaq, şəfəqləndirmək. **Nura boyanmaq (qərq olmaq)** – hər tərəf aydınlıq, işıq içərisində olmaq, şəfəq vermək, parlamaq. *Çilçıraqlar üstə yanır ağ şamlar; Möhtəşəm sütunlar nura boyanır.* S.Vurğun. *Günəş çoxdan doğmuş, ətrafı nura qərq eləmişdi.* Ə.Vəliyev.

2. *məc.* Maarif, aydınlıq, tərəqqi simvolu kimi işlənir. *Elm bir nur, cəhl zülmətdir; Cəhl duzəxdir, elm cənnətdir.* S.Ə.Şirvani. *Bir gün eşitdim ki, "Nicat" az qalır yer üzünün cəmi müsəlmanlarının qara qəlblərinə maarif nuru ilə nicat versin.* C.Məmmədquluzadə.

**NURANİ** *sif.* [*ər.*] 1. Nurlu, işıqlı, aydın.

2. *məc.* Hörmətli, hörmətə layiq, müqəddəs simalı, üzündən nur yağan. *Nurani qoca. – Bahadır o nurani kişini unutsa da, özünün bu qədər gücsüz qələmə verilməyinə razı olmadı.* M.Hüseyn. [Buğac:] *Burada bihuş yatarkən, ağsaçlı, ağsaqqallı nurani bir pir, .. mənə meydanda ad verən o qoca ozan gözümə göründü.* M.Rzaquluzadə.

**NURANİLİK** *is.* Nurani və hörmətə layiq adamın halı. *Beləliklə, günlər gəlib keçir. Mirzə Valehin dən düşmüş saqqalı dümağ olur, ətrafa bir nuranilik saçırdı.* S.Rəhimov.

**NURƏLƏNNUR** *sif.* [*ər.*] 1. Lap işıqlı. *Ətraf nurələnnur idi.*

2. *məc.* Yaxşıların yaxşısı, ən əla, ən yaxşı. *Hanı mərd igidlər, boş qalıb yurdu; Səxavətdə Eldar nurələnnurdu.* Aşıq Ələsgər. [Şeyx Səlim:] *Əgər belə iş görsəniz, lap nurələnnur olar ki.* P.Makulu.

**NURİ-ÇEŞMİM, NURİ-DİDƏM, NURİ-EYNİM** *köhn.* Çox istəkli, çox əziz adama nəvazişlə müraciət məqamında, ya onun haqqında deyilir: gözümün işığı (nuru). *Səni Yusif bilib verdim könül mülkündə sultanlıq; Əzizim, nuri-eynim, sən gəda oğlu gədasanmış.* S.Ə.Şirvani. [Yusif:] *Açım kağızı, görüm mənim əziz, nuri-çeşmim Şamdan bəy nə yazır?* N.Nərimanov. *Ah, nuri-didəm, halım nə qədər də qəmli, küskün; Bir şey yemək istəməzmi könlün?* H.Cavid.

**NURLANDIRMA** "Nurlandırmaq"dan *f.is.*

**NURLANDIRMAQ** *f.* 1. İşıqlı etmək, işıqlandırmaq. *Canlı bir məşəl; Qaranlıq gecəni nurlandırırdı.* M.Rahim. *Göy üzünə səpələnmiş, çiçək kimi açılmış ulduzlar ətrafı nurlandırmışdı.* Ə.Vəliyev.

2. *məc.* Maarifləndirmək, mədəniyyətə çağırmaq. *Xalqı nurlandırmaq.*

**NURLANMA** "Nurlanmaq"dan *f.is.*

**NURLANMAQ** *f.* İşıqlanmaq, parlamaq. *Üfüqlər bahar günəşinin ilk şəfəqləri ilə nurlanıb aydınlaşır.* M.Rzaquluzadə.

**NURLANMIŞ** *f.sif.* İşıqlanmış, işıq almış, işıq gəlmiş. *Maya .. ilahi məhəbbət duyğularının işığı ilə nurlanmış gözlərilə Qaraşı süzdü.* M.İbrahimov.

**NURLATMA** "Nurlatmaq"dan *f.is.*

**NURLATMAQ** *f.* İşıqlandırmaq, nura boyamaq, nura qərq etmək. *Gecənin nurladacaq alnını ay, ulduzlar; Səni yad eyləyəcək nazlı gəlinlər, qızlar.* S.Rüstəm.

**NURLU** *sif.* İşıqlı, aydın, parlaq. *Doğrudan da bir an içində sabahın bu nurlu çağında hava qapqaranlıq oldu.* M.Rzaquluzadə.

**NURSAÇAN** *sif.* İşıq saçan, ziya saçan, nur səpən. *Qoca Qaf dağından Şərqə nursaçan; Şanlı bir dövlətsən, azad, bəxtiyar.* Ə.Cəmil.

**NUŞ** *is.* [*fars.*] 1. *klas.* Dadlı, şirin. *Qeyrə eylər bisəbəb min iltifat ol nuş ləb; İltifat*

*etməz mənə mütləq, nədir bilməm səbəb.* Füzuli. *Mən zəhr bildiyim məni-miskinə nuş imiş; Biganə sandığım mənə xud aşina imiş.* S.Ə.Şirvani. □ **Nuş olmaq** – canına yatmaq (sinmək), xoş olmaq. *Nuş olur canıma ət, xasa o həngamdə kim; Mən yeyəm, xırda uşaqlar baxa, ağlaşa ətə.* M.Ə.Sabir. *Hər günümüz bir köçəri quş olur; Yar əlindən badə alsan nuş olur.* R.Rza.

2. İçki. □ **Nuş etmək (eyləmək)** – içmək. *Nuş etdim röyadə eşqin camını; Göründü gözümə doğru rah mənim.* "Aşıq Qərib".

◊ **Nuş olsun** – b a x **nuşcan**.

**NUŞCAN** [*fars.*] Çox vaxt "olsun" feli ilə canına nuş olsun! canına sinsin! *Nuşcan olsun, qardaşlar, doyunca yeyin, doymasanız, yenə verərik.* C.Məmmədquluzadə.

**NUŞCANLIQLA** *zərf* Ləzzətlə, həvəslə, canına sinə-sinə. *Nisə bərk acmışdı, əlin atıb armud ağacından bir neçə armud dərib nuşcanlıqla yedi.* (Nağıl).

**NÜANS** [*fr.*] Hər hansı bir şeydə (səsdə, rəngdə və s.-də) incə fərq; çalar. *Nüans – musiqidə ayrı-ayrı frazalara – cümlələrə çox zərif tərzdə keçməyə deyilir.* Ə.Bədəlbəyli.

**NÜCƏBA** *is.* [*ər.* "nəcib" söz. cəmi] Nəcib adamlar, əsilli adamlar; kübarlar, zadəganlar. *Belə idi adət əvvəl? Bəyə yalvarardı kasıb; Nücəbaləri görəndə ayağa durardı kasıb.* M.Ə.Sabir. [Mirzə Əsgər:] *Bir para adamı siz layiq bilmirsiniz, deyirsiniz ki, nanəcibdir, nücəbada da elə münasib oğlan yoxdur.* N.Vəzirov.

**NÜCUM** *is.* [*ər.* "nəcm" söz. cəmi] 1. Ulduzlar. *Kövkəblər! Ey səmanı müzəyyən qılan nücum; Etmişmidir o yerlərə də seyli-qəm hücum?* M.Hadi.

2. Ulduzlar və onların vəziyyətinə görə insan və onun taleyi haqqında hökm çıxarmağın mümkün olması haqqında orta əsr sxolastik elmi; elmi-nücum, astrologiya.

**NÜDRƏT** *is.* [*ər.*] Nadir olma, az tapılma, seyrəklik.

**NÜDRƏTDƏ** *zərf* Nadir hallarda, nadir olaraq, bəzən, arabir, əyyamda bir dəfə. *Nüdrətdə düşər şənbəyə novruz.* (Məsəl).

**NÜDRƏTƏN** *zərf* [*ər.*] 1. Hərdənbir, arabir, az-az, təsadüfdən-təsadüfə, nadir hallarda. *Elə güman etmək lazım gəlmir ki, yuxarıda rəvayət olunan nüdrətən ittifaq düşən bir işdir.* C.Məmmədquluzadə. [Ağdam bazarı] *tuhaf bir bazardır. Alış-veriş nüdrətən olur.* Ə.Haqverdiyev.

2. Birdən, gözlənmədən.

**NÜFUZ** *is.* [*ər.*] 1. Bir adamın sözü keçmə, hörməti, etibarı, təsiri olma; hörmət, etibar, təsir; avtoritet. *Naməlsəm camaatının arasında Əminin nüfuzu gündən-günə artır.* N.Nərimanov. *Cülus günündə iştirak etmək üçün xəlifə nüfuzu altında olan ölkələrin hökmdarları da öz mühafizə qoşunları ilə bərabər Bağdada gəlmişdi.* M.S.Ordubadi. □ **Nüfuz qazanmaq** – hörmət qazanmaq, hörməti, etibarı artmaq, avtoritet qazanmaq. **Nüfuzdan düşmək** – hörməti, etibarı itmək, əvvəlki etibarı qalmamaq. [Xəlil] *onun yanında nüfuzdan düşməsin deyə, işi birtəhər, zarafatla yola vermək istədi, zorla gülümsündü.* M.Hüseyn. **Nüfuzdan salmaq** – hörmətdən, etibardan salmaq, bihörmət etmək, alçaltmaq. [Sadıqov:] *Bu məni biabır etməkdir, nüfuzdan salmaqdır.* İ.Əfəndiyev.

2. Təsir etmə, keçmə, içəriyə işləmə. □ **Nüfuz etmək** – təsir etmək, işləmək, keçmək. *Qurban .. sümüklərinə qədər nüfuz edən soyuqdan bir yumaq kimi büzüşdü..* A.Şaiq. *Onun iti nəzərləri geniş üfüqlərə nüfuz edir.* M.Hüseyn. *May günəşi elə bil onun ürəyinin içinə qədər nüfuz edir.* S.Rəhman.

**NÜFUZEDİCİ** *sif.* Təsirli, təsiredici; ifadəli. *Nüfuzedici baxış. – Amma yenə də* [Əlyarov] *oğrun-oğrun qocanı süzürdü, gah onun ağarmış topa saqqalına, gah çuxurlarda gizlənmiş ağıllı və nüfuzedici gözlərinə .. baxırdı.* M.Hüseyn. [Nəcmi] .. *izdihamın ayrı-ayrı yerlərinə, sonra da Veysə, Zeynala diqqət edib nüfuzedici asta və qəti səslə dedi..* Ə.Əbülhəsən.

**NÜFUZLU** *sif.* Nüfuzu, hörməti, etibarı olan; sözükeçən. *Nüfuzlu adam.* – [Qəhrəman:] *Eşitdiyimə görə bu evin sahibi şəhərin ən böyük və nüfuzlu bəyi imiş.* H.Nəzərli. [Məsmə:] *..Onlar kənddə nüfuzlu, kəramət sahibi seyidlər hesab olunurdular.* S.Hüseyn.

**NÜFUS** *is.* [*ər.* "nəfs" söz. cəmi] 1. Əhali, camaat. [İskəndərzadə:] *..Bu arvad və uşaqlarına nüfus hesabı ilə nə qədər yer düşürsə, müəyyən edib versinlər.* Ə.Haqverdiyev.

2. *dan.* Çirkin, bədheybət, kifir adam. *Nüfusun biridir.*

**NÜHUSƏT** *is.* [*ər.*] *klas.* Uğursuzluq, bədbəxtlik, məşumluq, nəhslik. [Mövlana:] *Qibleyi-aləm bu əyyami-nühusətdə, yəni novruzdan on beş gün keçənədək gərək özünü səltənətdən xəl edə..* M.F.Axundzadə. *Biz müsəlmanlar indiyədək günlərin səadətini və nühusətini istəməmişik mülahizə eliyək..* C.Məmmədquluzadə.

**NÜKTƏ** *is.* [*ər.*] *klas.* Bir sözdən, ibarədən, ifadədən dolayısilə çıxarılan gizli, incə məna. *Bu pünhan nüktəni bir vaqifi-əsrar olandan sor.* Füzuli. *Sirri-dəhani məndən eşit, kim bu nüktənin; Təlif olan kitabələri əzbərimdədir.* S.Ə.Şirvani.

**NÜKTƏDAN** *is.* [*ər.* nüktə və *fars.* ...dan] *klas.* Sözdən, danışıqdan dərin incə məna çıxara bilən adam. *..Əhli-ürfan, nüktədan, şairsevən, aşiqpərəst; Bir müvafiq məhliqayi-mehriban sevmək gərək.* M.P.Vaqif. *Xəyalım hürr, can sərbəst, fikrim laübalidir; Məni azad edən sultani-əqli-nüktədanımdır.* M.Hadi.

**NÜKTƏLİ** *sif.* İçərisində incə və dərin, bilavasitə başa düşülməyən mənası olan. *Nüktəli söz.*

**NÜMAYAN** *sif.* [*fars.*] *klas.* Görünən, zahir olan, aydın olan. *Çay kənarında bir meşə qaralır; O biri yanda kənd nümayandır.* A.Səhhət. ◻ **Nümayan etmək (eləmək)** – görsətmək, zahir etmək, aşkar etmək. *Qəm büsatın xətm edibdir dövr Seyyid adına; Kim nəzərin dəhrdə hərgiz nümayan eyləməz.* S.Ə.Şirvani. *Zülmünü nümayan eylədin aşkar; Qurğular pozulub, sanlar itibdi.* Aşıq Ələsgər. **Nümayan olmaq** – görünmək, zahir olmaq, aşkar olmaq. *Abirudan məni sən saldın elə, ey idbar; Nagahan taki olub üzdə nümayan saqqal.* M.P.Vaqif. *Nümayan oldu nagah bir cənazə; Aparırlardı dəfn üçün məzarə.* S.Ə.Şirvani. *Hacı Mehdinin evi nümayan olur.* Ə.Haqverdiyev.

**NÜMAYƏNDƏ** *is.* [*fars.*] 1. Hər hansı bir kollektiv, təşkilat və s. tərəfindən seçilib bir yerə (məs.: konfransa, qurultaya və s.-yə) göndərilən və ya təyin edilən adam, vəkil edilmiş şəxs; müvəkkil. *Nümayəndə seçmək.* – *Qara Kərəm oğlu sözü deyib durdu və dönüb,* "*Yeni həyat*"*ın nümayəndələrinə baxdı.* M.İbrahimov. // Bir dövlətin və ya təşkilatın mənafeyini təmsil edən, rəsmi şəxs. *Diplomatik nümayəndə.*

2. Öz simasında hər hansı bir təbəqənin sinfi və ya fəaliyyət sahəsini təmsil edən, onların mənafeyini ifadə edən şəxs. *Xalqın ən qabaqcıl nümayəndələri. Səməd Vurğun Azərbaycan şerinin görkəmli nümayəndələrindəndir.*

**NÜMAYƏNDƏLİK** *is.* 1. Nümayəndə vəzifəsini, hüququnu yerinə yetirmə.

2. Hər hansı bir dövlətin, yaxud təşkilatın, idarənin və s.-nin mənafeyini təmsil edən müəssisə, idarə. *Ticarət nümayəndəliyi.*

**NÜMAYİŞ** *is.* [*fars.*] 1. Siyasi-ictimai əhval-ruhiyyəni ifadə etmək üçün düzəldilən kütləvi yürüş. – *1903-cü ildən etibarən bir-birinin ardınca fəhlə tətili və nümayişləri keçirməyə başlamışdı.* A.Şaiq. *Fəhlələr .. gurultulu nümayişlər düzəldib hər tərəfi titrədirdilər.* M.Hüseyn.

2. Bir şeyin geniş kütlələrə göstərilməsi. *Kinofilmlərin nümayişi.*

3. Bir şeyin təzahürü, bir şeyin varlığını göstərən. *Xalqın birliyinin nümayişi. Vətənpərvərliyin nümayişi.* ◻ **Nümayiş etdirmək** – göstərmək, bildirmək, ifadə etmək, təzahür etdirmək. *Çevik məktəbli gənclər öz bacarıq və hünərlərini nümayiş etdirirdilər.* M.Rzaquluzadə.

**NÜMAYİŞÇİ** *is.* Nümayişdə iştirak edən adam, nümayiş iştirakçısı. *Nümayişçilər şəhərin baş küçəsinə doğru ağır-ağır irəliləyirdi*(*lər*). A.Şaiq. *Bir dəqiqədə bütün küçə nümayişçilərlə doldu.* S.Rəhman.

**NÜMAYİŞKARANƏ** *zərf* [*fars.*] Nümayiş etdirərək, hamıya bildirərək, hamıya göstərmək üçün edilərək, nümayiş etdirmək üçün, göstərmək üçün, nəzərə çarpdırmaq üçün. *Nümayişkaranə iclası tərk etmək.* – ..[Təliə] *vəliəhdi tək buraxıb nümayişkaranə bir surətdə getməyin nəzakətsiz olduğunu zənn etdi.* M.S.Ordubadi.

**NÜMUNƏ** *is.* [*fars.*] 1. Hər hansı bir məmulatın, şeyin haqqında təsəvvür yarada biləcək hissəsi, örnəyi, qismi. *Yeni maşınlardan nümunə göstərmək.* – *Yusif .. torpaq nümunələrini elmi tədqiqat üzümçülük institutunda göstərdi.* B.Bayramov. // Başqa oxşar

şeylərin hazırlanması üçün əsas olan, örnək olan şey; model, çeşid. *Yeni mal nümunələri.*

2. Bir şeyin həqiqətən necə həyata keçdiyini göstərən əyani misal, canlı şahid. *Azərbaycan bütün Şərqə nümunə göstərilən azad bir ölkədir.* M.Hüseyn. "*Kəşkül*" *elm və mədəniyyətə çağırırkən bilavasitə Avropanın qabaqcıl ölkələrini nümunə alırdı.* M.İbrahimov. *Tikintidə necə işləmək lazım olduğunu göstərmək üçün* [Cəlil və Fərman] *canlı nümunə idilər*. Ə.Sadıq. ◻ **Nümunə olmaq** – bir neçə şeyin sırasında seçilmək, örnək olmaq. *Lap yaxşı olardı ki,* "*Təzə həyat*" *Bakı cəmiyyəti-xeyriyyəsi barəsində bir məqalə yazaydı və bizim üçün də bir nümunə olaydı*. C.Məmmədquluzadə.

**NÜMUNƏLİK** 1. Bax **nümunəvi** 1-ci mənada. *Nümunəlik mal.*

2. Bax **nümunə** 1-ci mənada. *Nümunəlik götürmək.*

**NÜMUNƏVİ** *sif.* [*fars.* nümunə və *ər.* ...vi] 1. Nümunə olan, nümunə ola biləcək. *Nümunəvi iş üsulları. – Bu məktəb .. nümunəvi dərs başlamağı öz əlindən vermək istəmirdi.* S.Rəhimov.

2. Başqalarına nümunə ola bilən, gözəl, əla, hamıdan yaxşı. *Nümunəvi tələbə*. – [Qətibə:] *Çünki şair mənim qeyd etdiyim asimani və nümunəvi kişilərdəndir*. M.S.Ordubadi.

**NÜSXƏ** *is.* [*ər.*] 1. Yazılı bir şeydən çıxarılan surətlərdən hər biri (əlyazmasının, yaxud çap olunmuş əsərin ayrıca surəti). *Hər il ölkədə yüz min nüsxələrlə kitab buraxılır*.

2. *məc. zar.* Pis və ya qəribə xasiyyətlərinə görə fərqlənən adam haqqında; tip, vücud. [Mirzə Səməndər:] *Qurban olum Məhəmmədin şəriətinə! Məhəmməd yaxşı bilirmiş ki, bu arvadlar necə nüsxədirlər*. C.Cabbarlı.

3. *köhn.* Resept. *Həkimlər, həkimlər, sizdən əlhəzər! Dərmanınız eyni, nüsxəniz eyni.* B.Vahabzadə.

4. *köhn.* Üzərində dua sözləri yazılmış kağız; dua.

**NÜSXƏBƏND** *is.* [*ər.* nüsxə və *fars.* ...bənd] *köhn.* 1. Aptekdə resept qəbul edən işçi; reseptçi, farmasevt.

2. Xalq təbabətində: qədim tibb kitablarına baxıb dərman yazan şəxs, yaxud həmin dərmanlar və onların hazırlanmasından bəhs edən kitab. *Hacı Nurməmməd də elə bizim öz şəhərimizdə nüsxəbənd kitablarının mütaliəsilə və təcrübə ilə həkimliyi öyrənmişdi.* C.Məmmədquluzadə. [Əvvəlinci kəndli:] *Həkim birgünlük yolda olur, .. qonşu kənddə bir otaylı nüsxəbənd var, həkimlikdən də azmaz başı çıxır.* Ə.Haqverdiyev.

**NÜSRƏT** *is.* [*ər.*] *köhn.* 1. Yardım, kömək. *Əgər Allah xana verə nüsrətlər; Zaye olmaz heç çəkdiyin zəhmətlər..* M.V.Vidadi.

2. Zəfər, qələbə.

**NÜTFƏ** *is.* [*ər.*] *biol*. Spermatozoid, məni, maya, toxum. [Zibeydə:] *Nə təfavütü! Nütfəsi ki əhli-zələmə nütfəsidir!* M.F.Axundzadə. [Rizvan:] *Hamının palçığı bir yerdən götürülüb, hamı bir nütfədən əmələ gəlibdir*. Ə.Haqverdiyev.

**NÜVƏ** *is.* 1. Bir şeyin daxili, mərkəzi hissəsi. *Atom nüvəsi* (*atomun mərkəzi, müsbət yüklü hissəsi*). *Yerin nüvəsi. – Çalağanlar Yer üzündə səs oğruları; Sərhədlərdən sərhədlərə ölüm çəkənlər; Meşə qırıb, dağ uçurub; Çay, dəniz yarıb; Yer şarının nüvəsinə nüvə əkənlər...* M.Araz. // *biol*. Hər cür bitki və heyvan orqanizmi hüceyrəsinin ən mühüm tərkib hissəsi. *Nüvə protoplazmaya nisbətən daha bərk olmaqla protoplazmanın özü ilə əhatə olunur*.

2. Nüvə daxilində baş verən proseslərə, atom nüvəsi enerjisindən istifadəyə aid olan. *Nüvə reaksiyası. Nüvə enerjisi. Nüvə silahı.* ◻ **Nüvə reaktoru (ya qazanı)** – içərisində atom nüvələrinin bölünməsinin zəncirvari reaksiyası əmələ gələn qurğu; atom reaktoru. **Nüvə fizikası** – fizikanın, atom nüvələri və onların təhəvvülatını öyrənməklə məşğul olan sahəsi.

3. *məc.* Bir şeyin, yaxud bir kollektivin, təşkilatın, qrupun əsas hissəsini, özəyini təşkil edən hissəsi; özək. *Qoşunların nüvəsini təşkil edən hissələr*.

**NÜVƏCİK** *kiç.* Kiçik nüvə.

**NÜVƏDAXİLİ** *sif. xüs*. Nüvə daxilində olan, nüvə daxilində əmələ gələn. *Nüvədaxili proses. Nüvədaxili enerji.*

**NÜZÜL** *is.* [*ər.*] *köhn.* Aşağıya enmə, nazil olma. ◻ **Nüzül etmək** *köhn.* – enmək, düşmək. *Paroxoddan çıxaraq körpüyə etdikdə nüzül; Deleqatlar tökülüb eylər idi rəsmiqəbul.* M.S.Ordubadi.

# Oo

**O**[1] Azərbaycan əlifbasının iyirmi birinci hərfi. // "O" hərfi ilə işarə olunan saitin adı.

**O**[2] Üçüncü şəxs əvəzliyinin təki; haqqında danışılan və ya göstərilən şəxsi bildirir. *O gəldi. – Aşıq Qərib sözün deyər avazla; Dindirəndə canım alar o, nazla.* "Aşıq Qərib". *İndi Ziba hər axşam onun yanına gəlib, ona bir çox şeylər danışıb nəql edirdi.* S.Hüseyn.

**O**[3] *iş. əvəz.* 1. Zaman və ya məkan daxilində bilavasitə göz qabağında olmayan, yaxud uzaq olan şeyi göstərir, həm də ismə konkretlik verir (*bu* müqabili). O *kitablar mənimdir. O otaqda kim yaşayır? – Əsmər o evə heç getməmişdi.* S.Hüseyn.

2. Qoşa olan iki şeyin ikincisini göstərir (*bu biri* müqabili). *Yolun o tərəfində. Gölün o sahili. – ..Molla Güləndam bacı on-on beş qız ilə çəpəri basıb o taya keçdilər.* Çəmənzəminli.

3. *İs. mənasında*. Haqqında danışılan, göz qabağında olmayan və ya uzaqda olan hadisə, şey. *O mümkün deyil.* – [Cahan:] *Evlənmək su içmək kimi asan şeydir, onda nə çətinlik var ki?* Ü.Hacıbəyov.

◊ **O biri** – 1) başqa, digər, özgə, o. *O biri otaqdan Məşədi İbadı gətirirlər.* Ü.Hacıbəyov. *O biri xəstələrin sözlərini aydın eşitmədim.* M.Hüseyn; 2) gələn, növbəti, sonrakı. *O biri dəfə gələrəm;* 3) ertəsi, sabahı. *O biri gün onu görmədim.* **O cümlədən** – çox şey və ya çox adam arasından bir şeyi və ya bir adamı ayırıb göstərmək üçün işlədilir. *Hamı, o cümlədən mən də orada idik. – Zeynalabdin uşaqları, o cümlədən Güldəstəni tanıdı.* H.Seyidbəyli. **O gün olmaz (olmayıb)** – həmişə, hər gün. *O gün olmaz bizə gəlməsin.* – [Qadir Sonaya:] *O gün olmayıb karxanaya getməyəsən, lülə sarımayasan.* Ə.Əbülhəsən. **O halda** – o vəziyyətdə, o zaman. [Şah:] *O halda bizim qanımız sənə halaldır.* Ü.Hacıbəyov. **O ki qaldı** – ...haqqında danışsaq, ...gəlincə, ...gəldikdə. *O ki qaldı hökumət məktəbləri, .. burada, bir nəfər sarıqlı müəllim, əlbəttə, tapılar.* C.Məmmədquluzadə. **O ki var** – çox, həddən artıq; lap çox. *Lotular o ki var yedilər.* "Aşıq Qərib". **Onunla belə** – ...baxmayaraq. **Onunla bərabər** – eyni zamanda, yanaşı olaraq, birlikdə.

**O**[4] *nida*. Heyrət, təəccüb bildirir (bəzən təkrar edilərək işlədilir). *O! Bu kimdir? O! Bu heç olmadı.*

**OBA** *is.* 1. Bir neçə evdən ibarət kiçik yaşayış məntəqəsi, kiçik kənd. [Şahmar:] *Baharlıdan bura gələndə elə bilirsən, şəhərdən yöndəmsiz bir obaya gəlirsən.* B.Bayramov.

2. Köçərilərin, heyvandarların müvəqqəti sakin olduqları bir neçə alaçıq və ya çadırdan ibarət köç yeri; köçəbə, düşərgə. *Çoban obası. – Qurban .. obalara gedib süd almalı və ağalar üçün çobanaşı bişirməli idi.* T.Ş.Simurq. *Hər il bu zaman yolun ətəklərinə qədər çadırlar, obalar düşərmiş.* Mir Cəlal.

**OBABAŞI** *is. köhn.* Obaya başçılıq edən adam, oba ağsaqqalı.

**OBAŞDAN** *zərf* 1. Alaqaranlıq, səhər tezdən, hava açılmamış. *Obaşdan oyanmaq. – Aslan isə, – vaxt keçir, – deyə obaşdan gedib vağzalı kəsdirib oturdu.* C.Cabbarlı. *Çiynindən aşırıb boz çantasını; Obaşdan məktəbə bir uşaq gedir.* H.Arif.

2. Orucluqda hava açılmamışdan, alaqaranlıqda dindar müsəlmanların yemək yedikləri vaxt. *Orucluqda bir axşamdan, bir də obaşdandan yeyərdilər ki, bütün günü ac qalmağa imkan olsun.* H.Sarabski.

**OBAŞDANLIQ** *is.* Oruc tutan müsəlmanların obaşdanda yedikləri yemək. [Arvad:] *Sən gündüzləri oruc tutmursan, gecələri obaşdanlığa durursan.* "M.N.lətif." *Minacat səsinə yuxudan ayılanlar obaşdanlıqla məşğul olub taam yeyirdilər ki, sabah oruc olacaqlardı.* B.Talıblı.

**OBELİSK** [*yun.* obelisikos, hərfi mənası – kiçik şiş] Yuxarıya doğru getdikcə naziklәşən, yonulmuş daş sütundan ibarət abidə. *Obelisk qoymaq. Obeliskin açılışı.*

**óber**... [*alm.* ober – baş, böyük] Bir sıra xarici ölkələrdə bəzi dövlət rütbələri və mülki vəzifələri bildirən sözlərə artırılan ön sözü; məs.: ober-leytenant, ober-polismeyster, ober-burqomistr.

**OBERTÓN** [*alm.* Obertone] *mus.* Əsas tona xüsusi çalarlıq, tembr verən əlavə ton. *Bu* [titrəyən] *səslər əsas səsi müşayiət edərək,*

*ona nisbətən zil olacaqlar ki, bunlara da oberton deyilir.* “İbtidai musiqi”.

**ÓBLAST** *is.* [*rus.*] Çoxölçülü fəzanın və ya metrik fəzanın yalnız daxili nöqtələrindən ibarət olan əlaqəli çoxluğu.

**OBLİQÁSİYA** *is.* [*lat.*] Qiymətli kağızların bir növü.

**OBLOMOVÇULUQ** *is.* [İ.Qonçarovun “Oblomov” romanının qəhrəmanı Oblomovun adından] Atillik, ifadəsizlik; fəaliyyətsizlik və tənbəllik halı.

**ÓBRAZ** *is.* [*rus.*] Obyektin insan şüurunda obyektiv inikas forması; surət.

**OBRAZLI** *sif.* [*rus.* образ sözündən] İfadəli, canlı, aydın (danışıq və s. haqqında). *Obrazlı ifadə. Obrazlı* (z.) *danışmaq. – X.Rza real bədii təsvirə, obrazlı düşüncəyə, ifadə vasitələrinin təravətinə həmişə üstünlük verirdi.* B.Nəbiyev.

**OBRAZLILIQ** *is.* Obrazlı olma; ifadəlilik, canlılıq, aydınlıq (danışıq və s. haqqında). *Nitqin obrazlılığı. – Milli və beynəlmiləl münasibətlər problemi .. dünya ədəbiyyatında öz mütərəqqiliyini, obrazlılığını, nadir əhatəliyini və məhsuldarlığını bir daha Vahabzadə yaradıcılığında tapır.* Ç.Aytmatov.

**OBSTRÚKSİYA** [*lat.* obstructio – maneçilik] Səs-küy salmaq, məsələyə aid olmayan uzun-uzadı çıxışlar etmək və b. yollarla iclası, yığıncağı uzatmaq və ya pozmaq (əsasən parlament mübarizəsi) üsulu.

**OBSTRUKSİONÍST** [*lat.*] Obstruksiya iştirakçısı və ya tərəfdarı.

**OBSTRUKSİONÍZM** [*lat.*] Obstruksiyalar yolu ilə siyasi mübarizə üsulu.

**O-BU** *is.* Hər kəs, adamlar. *Ondan-bundan soruşmaq. Onun-bunun sözünə baxma. O-bu nə deyər? – Uşaq ona-buna toxuna-toxuna gedirdi.* Çəmənzəminli.

**OBYÉKT** [*lat.* objectum – şey] 1. *fəls.* Bizdən kənarda və şüurumuzdan asılı olmayaraq mövcud olan xarici aləm, maddi varlıq.

2. Hər hansı bir şəxsin fəaliyyətinin, diqqətinin və s. yönəldildiyi hadisə, şey; hədəf, mövzu, bəhs. *Tədqiqat obyekti. Müşahidə obyekti.*

3. Müəssisə, tikinti, yaxud bir şeyin təsərrüfat və ya müdafiə əhəmiyyəti olan ayrıca vahidi. *Müdafiə obyekti. Tikinti obyekti.* – [Aslan:] *..Belə böyük obyektlərdə işləməyə varam.* S.Rəhman. *..Burda nə hərbi obyekt vardı; nə anbar, nə qoşun bölməsi.* R.Rza.

**OBYEKTÍV**[1] *sif.* [*lat.* objectivus – şeyə aid olan] 1. Şüurdan kənarda və ondan asılı olmayaraq mövcud olan. *Təbiətin obyektiv qanunları.*

2. Qərəzsiz, tərəf tutmayan, bitərəf. *Obyektiv nəticə. Hadisələrə verilən obyektiv qiymət.*

◊ **Obyektiv reallıq (gerçəklik)** – şüurdan kənarda və ondan asılı olmayaraq mövcud olan hər şey.

**OBYEKTÍV**[2] [*lat.*] Optik cihazın, baxılan və ya fotoşəkli çəkilən şeyə yönəldilmiş bir və ya bir neçə linzadan ibarət hissəsi. *Fotoaparatın obyektivi. Mikroskopun obyektivi.*

**OBYEKTİVCƏSİNƏ** *zərf* Qərəzsizcəsinə, bitərəfcəsinə. *Obyektivcəsinə təhqiqat aparmaq.*

**OBYEKTİVÍZM** [*lat.*] 1. B a x **obyektivlik** 2-ci mənada.

2. İctimai həyatdakı hadisələrə onları passiv surətdə qeyd etmək və beləliklə də onların zəruri olduğunu təsdiq etməyə və doğrultmağa aparıb çıxaran münasibət.

**OBYEKTİVLİK** *is.* 1. Bir şeyin şüurdan asılı olmayaraq müstəqil bir obyekt kimi mövcud olması. *Xarici aləmin obyektivliyi.*

2. Qərəzsizlik; bir şeyə qiymət verərkən bitərəflik göstərmə. *Mühakimənin obyektivliyi.*

**OCAQ** *is.* 1. Xörək bişirmək, su, yaxud evi qızdırmaq üçün bir tərəfi açıq, üç tərəfi daşdan, kərpicdən hörülmüş kiçik tikili; ümumiyyətlə, od yandırmaq üçün yer. *Ocağa odun qoymaq. Ocaqda xörək bişirmək. – Kərbəlayı Qurban başmaqlarını çıxardıb ocağın qırağında oturdu.* Çəmənzəminli. *Daxma qaranlıq idi, ancaq ocağın işıltısından künc-bucağı seçmək olurdu.* Ə.Vəliyev. ☐ **Ocaq qalamaq** – ocağa odun qoyub yandırmaq. *Bu, əti doğrayır, o, ocaq basır; Bu, çörək bişirir, o, qazan asır.* H.K.Sanılı. [Məzlum Aslana:] *Dünən* [komendantın] *otağında ocaq qalayırdım.* S.Vəliyev.

2. *xüs.* Sobanın və ya buxar qazanının yanacaq yandırılan yeri, hissəsi. *Parovozun ocağı. – Nəhəng ocaqların yeknəsəq uğultusu eşidilirdi.* H.Seyidbəyli. // Kirəc yandırılan yer.

3. *din*. Pir, müqəddəs yer, ziyarətgah. [Sönməz:] *Ərəblər əvvəlləri heç olmazsa böyük mərkəzlərdəki ocaqlara, ibadətxanalara toxunmurdular.* C.Cabbarlı. *Şəhərdə böyük möcüzələr görünmüşdü, çoxlu ocaqlar, pirlər zühur etmişdi..* Çəmənzəminli.

4. *məc.* Doğma ev, ev-eşik, yurd. *Göz dikərək yad ellərin şəfa verməz ocağına; Böylə qərib bir parçacıq, kəfənsizmi öləcəyəm?* A.İldırım.

5. *məc.* Bir şeyin olduğu, törədiyi, yayıldığı yer; mərkəz; mənbə. *Maarif ocağı. Elm ocağı.*

◊ **Ocaq yanmasa tüstü çıxmaz** – bir şeyin səbəbsiz olmadığını, bir şey haqqında əsassız danışılmadığını bildirən atalar sözü. *Nə isə, ocaq yanmasa tüstü çıxmaz, deyiblər.* B.Bayramov. **Ocağını söndürmək (kor qoymaq)** – evini xaraba qoymaq, ailəsini dağıtmaq. [Turac Gülsabaha:] *Sən neçin bizim ocağımızı söndürürsən?* C.Cabbarlı.

**OCAQÇI** *is.* Ocağa, buxar qazanlarına xidmət edən adam (b a x **ocaq** 2-ci mənada). *Hamamın ocaqçısı.* – [Babakişi:] *Deməli, Atakişi qazançıdır, mən də, türkün sözü, ocaqçı.* C.Cabbarlı. *Zakir isə ocaqçını çağırdı və bacalardan çıxan tüstünü göstərib acıqlandı.* H.Seyidbəyli.

**OCAQÇILIQ** *is.* Ocaqçının işi, vəzifəsi. *Ocaqçılıq etmək.* – [Sayad:] *Bilmirəm necə deyim ki, sözlərimdən inciməyəsən. Axı, Xəlil hara, ocaqçılıq hara?* İ.Məlikzadə.

**OCAQXANA** *is.* Buxar qazanlarının yerləşdiyi yer, bina. *Ocaqxananı təmir etmək. Ocaqxana isti idi.*

**OCAQLIQ** b a x **ocaq** 4-cü mənada.

**OCIĞAZ** *əvəz.* "O"dan *oxş*. *Ocığaza yazığım gəldi. Ocığaz bərk xəstədir.*

**ÓÇERK** *is.* [*rus.*] 1. Müəllifin bilavasitə gördüyü, şahidi olduğu real faktlardan, hadisələrdən, adamlardan bəhs olunan kiçik ədəbi əsər. *Hərbi oçerk. Qəzetdə maraqlı oçerk var.*

2. Bir-biri ilə əlaqəli məsələlərə həsr olunmuş xüsusi elmi əsərin adı (əsasən cəmdə işlədilir). "*Ümumdünya tarixinə dair oçerklər*". "*Azərbaycan ədəbiyyatı oçerkləri*".

**OÇERKÇİ** *is.* Oçerk yazan jurnalist və ya yazıçı; oçerkist.

**OÇERKİST** [*rus.*] b a x **oçerkçi**.

**OD** *is.* 1. Yanan bir şeydən çıxan qazlar; atəş. *Odu söndürmək. Odda yanmaq. Odda qızdırmaq. Kömür odu.* // *məc.* Obrazlı təşbehlərdə şiddətli hissiyyatın, ehtirasın, coşqunluğun, ruh yüksəkliyinin rəmzi kimi işlənir. *Qəlbi od dənizi, gözüdür Bakı; Doğma Vətənimin gözüdür Bakı.* B.Vahabzadə.

2. Çox bərk isti. *Göydən sanki od yağırdı. Nəfəs almaq çətin idi.* S.Vəliyev.

3. *məc.* Qızartı, qırmızılıq; hərarət. *..Yanaqlarının odu hələ də sönməyən qız .. anasının üzünə baxa bilmirdi.* B.Bayramov. □ **Od parçası** – çox zirək, diribaş, bacarıqlı adam haqqında. [Canəli:] *Ay maşallah, sən lap od parçasısan ki... Mən bu andırın dilini bir aya güclə öyrəndim...* İ.Məlikzadə. // Nadinc, yıxıb-dağıdan, daim hərəkətdə olan uşaq haqqında. *Uşaq deyil, od parçasıdır.*

4. *məc. dan.* Ev, ailə, ocaq. *Bu kənd üç yüz oddan ibarətdir.* □ **Od qonşusu** – yaxın, qapıbir qonşu. *Gərdənlər çəkili, baxışlar soyuq; Sanki xəbərsizik, od qonşusuyuq.* M.Araz.

◊ **Od aparmış!** – qarğış mənasında (əsasən uşaq haqqında deyilir). **Od(u) ayaqlamaq** – bir şeyi əldə etmək və ya məqsədə çatmaq üçün çox çalışmaq, səy göstərmək. **Od eləmək** – atəş açmaq, odlu silahla vurmaq. *Gecənin bir vaxtı ortalıqda hazır toyuğu görən tülkü onu qapmağa gələndə* [Yaşarın] *atası od eləyib tülkünü vurmuşdu.* M.Rzaquluzadə. **Od götürmək** – bərk hirslənmək, özündən çıxmaq, od tutmaq. *Bu sözdən od götürdü. – Xalıqverdi kişini yenə də od götürdü.* Ə.Vəliyev. *Gülzarı od götürdü. Nə danışdığını özü də bilmədi.* İ.Hüseynov. **Od ilə su arasında qalmaq** – çıxılmaz vəziyyətə düşmək, nə edəcəyini bilməmək. [Cavad:] *Səfər bəy qıza bənd olub, istəyir ki, kəbinini kəsdirib, evinə aparsın, mən də qalmışam odla su arasında.* B.Talıblı. *Sanitar yaralının çox əsəbiləşdiyini görüb odla su arasında qalmışdı.* M.Hüseyn. **Od kimi** – 1) çox isti, qaynar, qızmar. *Çay od kimidir. Dəmirə əl vurmaq olmur, od kimidir;* 2) çox cəld, sürətlə, becid. *Od kimi getmək.* **Od tutub yanmaq** – qızdırması qalxmaq, hərarəti yüksək olmaq, bərk qızdırmaq. *Dürrə qızdırmadan od tutub yanırdı.* S.Vəliyev. *Şahpərinin od tutub yanan*

*bədəni bircə an içində soyudu*. B.Bayramov. ...**od vurmaq** – divan tutmaq, cəzalandırmaq. *Uca, qocaman dağlarda bütün millətlərin mərd oğulları .. işğalçılara od vururdular*. S.Vəliyev. **Odla oynamaq** – nəticəsi fəlakətlə qurtara biləcək bir iş görmək. *Elə ki yandım; Odla oynamaqdan qorxdum, dayandım*. B.Vahabzadə. **Odlar yurdu (ölkəsi)** – obrazlı ifadə kimi "Azərbaycan" mənasında işlədilir. [Leyla:] *Sən Odlar yurdunun öz övladısan!* B.Vahabzadə. **Odu söndürüb külü ilə oynamaq** – əsas məsələni qoyub ikinci dərəcəli məsələ ilə məşğul olmaq, böyük işi qoyub kiçiyindən yapışmaq. **Odu yatırılmaq** – sakitləşdirilmək, aram edilmək.

**ODA[1]** Otaq. *Zeynal geniş bir şüşəbəndi keçib yemək odasına girdi*. S.Hüseyn. *Teatrın aktyor və aktrisaları qabağımıza çıxıb bizi teatrın qonaq odasına dəvət etdilər*. C.Cabbarlı.

**ODA[2]** *is*. [*yun.*] *ədəb*. Lirik şeir və musiqi janrı.

**ODABAŞI** *is. köhn*. Keçmişdə mehmanxanalarda, karvansaralarda və s.-də otaqlara baxan və onların açarlarını saxlayan adam. [Odabaşı:] *Elə ölən gündən məni cəhənnəmdə odabaşı ediblər*. Ə.Haqverdiyev.

**ODADAVAMLI** *sif. xüs*. Yüksək hərarətə davam gətirən. *Odadavamlı gil. Odadavamlı kərpic*.

**ODADAVAMLILIQ** *is. xüs*. Odadavamlı şeyin xassə və keyfiyyəti. *Gilin odadavamlılığı.*

**ODADAVAMSIZ** *sif. xüs*. Yüksək hərarətə davam gətirməyən. *Odadavamsız kərpic*.

**ODADAVAMSIZLIQ** *is. xüs*. Oda davamı olmayan şeyin xassə və keyfiyyəti.

**OD-ALOV** 1. *top*. Alovla yanan od. *Qaranlıqda od-alov görünür*.

2. *məc. is*. və *sif*. Zirək, diribaş, çevik, bir yerdə qərar tapmayan, nadinc (əsasən uşaq haqqında). *Evin balaca qızı Ulduz isə anasının təbirinə görə od-alov idi*. Ə.Məmmədxanlı. *Odun-alovun biridir, – deyə* Zakir [Nailəni] *göstərdi*. H.Seyidbəyli.

3. *məc. sif*. Qırmızı mənasında. *Bayraqlar yellənir od-alov rəngli*. R.Rza.

**ODEKOLÓN** [*fr*. eau de Cologne – Köln şəhərinin suyu] Kosmetik maddə kimi işlədilən ətirli, spirtli məhlul. *Odekolon şüşəsi. Yasəmən odekolonu*. – [Həkim:] *Firuzənin böyük bir həzlə ərinin üzərinə odekolon səpdiyini .. aydınca görürdüm*. C.Cabbarlı. [Tahir] *saçına odekolon vurub, səliqə ilə daradı*. M.Hüseyn.

**ODEKOLONLU** *sif*. Odekolon vurulmuş, odekolon səpilmiş. *Odekolonlu yaylıq*.

**ODLAQ** *is*. Od düşüb alışan, yanan yer, habelə oradan qalxan alov. // Yanıb sönmüş yer, yanmış bir yerin izi.

**ODLAMA** "Odlamaq"dan *f.is*.

**ODLAMAQ** *f*. 1. Od vurub yandırmaq, yanğın törətmək. *Ocağı odlamaq. Tonqalı odlamaq*. // Alışdırmaq, yandırmaq. [Hüseynəli əmi] *..dəri kisənin içərisindən çaxmağı və daşı götürüb qovu odladı..* M.S.Ordubadi. *Nəriman dərhal fitili odladı*. Mir Cəlal.

2. *məc*. Odlu silahla öldürmək, ya yaralamaq. [Sərvər Məşədi İbada:] *Danışma, yaz, yoxsa odlaram səni!* Ü.Hacıbəyov.

3. *məc*. Bərk hirsləndirmək, əsəbiləşdirmək, özündən çıxartmaq. *Qapıçıların sözləri Talış xanı odlayırdı*. Çəmənzəminli.

**ODLANDIRILMA** "Odlandırılmaq"dan *f.is*.

**ODLANDIRILMAQ** *məch*. Od vurub yandırılmaq, yanğın törədilmək. *Taya odlandırıldı*. // Alışdırılmaq, yandırılmaq. *Papiros odlandırıldı*.

**ODLANDIRMA** "Odlandırmaq"dan *f.is*.

**ODLANDIRMAQ** b a x **odlamaq**. *Siqareti odlandırmaq. Tonqalı odlandırmaq*.

**ODLANMA** "Odlanmaq"dan *f.is*.

**ODLANMAQ** *qayıd*. 1. Yandırılmaq, yanğın törədilmək. *Evi odlanan mən, əli kösövlü sən*. (Ata. sözü). // Od düşüb yanmaq, alışmaq, alışıb-yanmaq. [Yaqut] *yanan canının ağrısını əks etdirən dəhşətli bir səslə: – Burax məni, Yunus, .. burax, sən də odlanacaqsan! – deyə qışqırıb qucağımda çırpınırdı*. Ə.Məmmədxanlı.

2. Odlu silahla öldürülmək, ya yaralanmaq. *Uça bilmirdilər, odlanırdılar; Şama dəyib yanan pərvanə kimi*. M.Rahim.

3. *məc*. Bərk hirslənmək, əsəbiləşmək. *Özündən çıxmaq*. [Ruhnəvaz] *Qurbanlıya qarşı göstərdiyi laqeydliyi və etinasızlığı xatırlayıb odlandı*. Çəmənzəminli.

**ODLU** *sif*. 1. Odu olan; yanar, alovlu, közərən. *Odlu ocaq*. – *Çox zaman qurduğum tələ-*

*dəki quşlar yerinə gözlərimə anamın dəhşətlə təsvir etdiyi əllərində odlu kösövlər olan inkir-minkirlər görünürdü.* M.İbrahimov. *Səbzəlinin dodaqlarından papirosun odlu qoru tökülürdü.* S.Rəhimov. ☐ **Odlu silah** – barıt, yaxud başqa partlayıcı maddələrin alışması ilə atılan silah (tüfəng, tapança və s.).

2. *məc.* Qırmızı, od rəngli. *Onun dalısınca yarır mənim də; Odlu üfüqləri xəyalım yenə.* M.Rahim.

3. *məc.* Ehtiraslı, coşqun, yanar. *Alaçıqdan on-on beş arşın ucada böyük bir quş iri qanadlarını açmış, odlu və acıqlı baxışlarla bizi süzürdü.* A.Şaiq. *Sanki Sədəf* [Sonanı] *odlu baxışları ilə əridir, .. yandırıb-yaxırdı.* B.Bayramov. // *məc.* Atəşin, ehtiraslı, qızğın, hərarətli, coşqun. *Odlu məhəbbət. Odlu salamlar. Odlu ehtiras. – Nədən söyləməsin ana dililə; Öz odlu nitqini yoldaş komissar?* S.Vurğun. *O, o qədər odlu* (z.) *danışırdı ki, tər başından üzünə, boyun-boğazına sızıb tökülürdü.* Ə.Vəliyev.

4. *məc.* Təsiredici, təsirli, yanıqlı, yandırıcı, yaxıcı. *O qədər keçmədi qarşıkı dağdan; Ucaldı bir qəlbin odlu naləsi.* S.Vurğun. *Ürəyindəki odlu bir həsrətlə yalvarırdı.* Mir Cəlal.

**odlu-odlu** *zərf* Ehtirasla, hərarətlə, qızğın surətdə. *Odlu-odlu* [Rüstəm Mayaya] *bildirdi ki, hər yerdə və hər zaman kişinin borcu qadına hörmət etməkdir, ona qulluq göstərməkdir.* M.İbrahimov.

**ODLU-ALOVLU** *sif.* və *zərf* 1. Gərgin, şiddətli, dəhşətli, qızğın. *..Hər yerdə odlu-alovlu vuruş gedir, nəriltili-gurultulu atışma kəsmək bilmirdi.* S.Rəhimov.

2. B a x **odlu** 3-cü mənada. *Odlu-alovlu danışmaq. Odlu-alovlu nitq.*

**ODLUQ** *is.* 1. Samovar, soba və s.-də od yanan hissə. *Lampanın odluğu. – Odluq içərisinə doldurulmuş ulas ağacının mis kimi möhkəm kömürləri qıpqırmızı qızarır, samovar yırğalanır, sanki ayaqlanıb yeriyirdi.* S.Rəhimov.

2. *köhn.* İbtidai tüfənglərdə, toplarda: barıtın alışdırıldığı hissə. *Tüfəngin odluğu.*

**OD-OCAQ** *top.* Ocaq, tonqal, soba və s. *Kür qırağı, Qarayazı, göy çəmən; Qoşa palıd, tüstülənən od-ocaq!* S.Vurğun. *Enirəm qazmaya; Qazma soyuq, dar; Od-ocaq yoxsa da bir işıltı var.* Ə.Cəmil.

**ODPÜSKÜRDÜCÜ, ODPÜSKÜRƏN** *sif.* İçərisindən od çıxan. *Odpüskürən dağ* (*vulkan*).

**ODSAÇAN** *is.* Yanar maye saçan odlu silah. *Xüsusi ağır mina və odsaçan batareyalar, ağır top və tanklar gətirildi.* Ə.Əbülhəsən.

**ODSÖNDÜRƏN** *is.* Yanğını söndürmək üçün xüsusi cihaz. [Zabit soldatları:] *Tez şlanqları alın, odsöndürəni! Tez olun, tez!* S.Vəliyev.

**ODUN** *is.* 1. Yandırmaq üçün kəsilmiş və doğranmış ağac parçası; ağac yanacağı. *Yaş odun. Doğranmış odun. – Odunlar alışıb çıtırtı ilə yanmağa başlayanda bir neçə addımlıq yer işıqlandı.* M.Hüseyn. *Qərənfil xala quru odunlardan sobaya doldurdu.* Ə.Vəliyev.

2. *məc.* Hissiz, hissiyyatını itirmiş, keyləşmiş, hərəkətsiz adam haqqında. // *məc.* Qaba, kobud, qalınqafa adam haqqında.

**ODUNCAQ** *is.* Ağacın, yaxud kolun qabıq altında olan ən sıx, bərk hissəsi.

**ODUNCAQLAŞMA** "Oduncaqlaşmaq"dan *f.is.*

**ODUNCAQLAŞMAQ** b a x **odunlaşmaq**.

**ODUNÇU** *is.* Meşədən odun doğrayıb satmaqla məşğul olan adam. *Gedər odunçu meşəyə, ağac qırar, odun kəsər.* A.Səhhət. *Odunçu öz iki oğlu ilə odun yığır.* Ü.Hacıbəyov.

**ODUNÇULUQ** *is.* Odunçunun işi, peşəsi, odun doğrayıb satma işi. [Qurban:] *Axırda əlacım kəsildi, başladım odunçuluğa.* Ə.Haqverdiyev.

**ODUNXANA** b a x **odunluq** 2-ci mənada.

**ODUNKƏSƏN** *is. zool.* Ağacların, kolların qabıq və oduncağını yeyən böcək və onun sürfəsi.

**ODUNQIRAN** 1. *sif.* Odun qırmaq üçün işlədilən, odun doğramağa məxsus. *Əhmədin arvadı Nisə götürüb odunqıran baltanı üz qoydu meşəyə.* (Nağıl).

2. B a x **odunçu**.

**ODUNLAŞMA** "Odunlaşmaq"dan *f.is.* *..Fosfor gübrəsi meyvələrin inkişafını, kalium gübrəsi isə zoğların inkişafını və vaxtında odunlaşmasını təmin edir.* İ.Axundzadə.

**ODUNLAŞMAQ** *f.* 1. Bərkiyib ağaca dönmək; oduncaqlaşmaq (bitkilərin zoğları haqqında).

2. *məc.* Keyləşmək, hissizləşmək, oduna dönmək.

**ODUNLUQ** *sif.* 1. Odun üçün yarayan, odun kimi kəsmək üçün ayrılmış. *Odunluq ağac.*

2. Odun saxlanılan yer, odun anbarı. *Doğranmış odunu odunluğa yığmaq.*

**OD-YALOV** b a x **od-alov**. [Məşədi Müslüm:] *..Demə qız od-yalov imiş.* Mir Cəlal.

**OF** b a x **uf**. [Əsgər Cahana:] *Of, ay xala! Yenə bilmədin nə istəyirəm?..* Ü.Hacıbəyov. *Of, həyat nə qədər şirindir.* Mir Cəlal.

**OFİSİÁNT** *is.* [*lat.*] Restoranda, aşxanada xörək paylayan.

**OFSÉT** [*ing.* offset] Çap üsulu: bu üsulda çap qəlibi üzərindəki rəng (şəkil) rezin lövhəyə, oradan da kağız üzərinə köçürülür.

**OFTALMOLÓGİYA** [*yun.* oftalmos – göz və logos – elm, nəzəriyyə] Göz xəstəlikləri və onların müalicəsi üsullarından bəhs edən elm.

**OĞLAQ** *is.* Körpə, südəmər keçi balası; çəpiş. *Analarını əmməsinlər deyə quzuları, oğlaqları bir ağıla doldururdular.* A.Şaiq.

**OĞLAN** *is.* 1. Kişi cinsdən olan uşaq. *Uşaqlarından biri oğlandır, ikisi qız.* – [Arvad:] *Aradan bir az keçdi, Allah vurdu, mənə bir oğlan da verdi.* Çəmənzəminli.

2. Həddi-büluğa çatmış, lakin hələ evlənməmiş gənc. *Getdim alagözlü yarla danışam; Dedi: – Oğlan, dur get, söz vaxtı deyil.* M.P.Vaqif. *Nazim də Nəcibə kimi atasız-anasız böyümüş bir oğlan idi.* Mir Cəlal.

◊ **Oğlan gəlmisən, ya qız?** – tapşırığı yerinə yetirib yetirmədiyini bilmək üçün birinə zarafat təriqində verilən sual. **...oğlan çağı** – adətən fəsillərin adı ilə işlənib onların əsas xüsusiyyətlərini özündə əks etdirən dövrünü bildirir. *Qışın oğlan çağı idi, bərk qar yağırdı. – Yazın oğlan vaxtı, selli çağları; Qanıq ilə Qavrı, bir də dəli Kür; Birləşib üçü də, uçurur, tökür.* H.K.Sanılı.

**OĞLANCIĞAZ** "Oğlan"dan *oxş*. *Oğlancığaz bərk xəstədir.*

**OĞLANCIQ** *is.* Kiçik oğlan uşağı.

**OĞLANLIQ** *is.* Kişi cinsinin evlənənə qədər olan halı, oğlan olma dövrü.

**OĞLANLI-QIZLI** *top.* Həm oğlan(lar), həm də qız(lar), oğlanlarla qızlar birlikdə. *Oğlanlı-qızlı köməyə gəlmək.* – [Yaşlı kişi:] *Oğlanlı-qızlı bir araya toplaşır, Şərəf xalagilin ağ və təmiz qumdan ibarət olan təpəliyində oynardıq.* S.Hüseyn. *..Oğlanlı-qızlı hamısı çayın o tayına addamaq istəyirlər.* Ə.Vəliyev.

**OĞRU** 1. *is.* Oğurluq edən adam, oğurluqla məşğul olan adam. *Casusmusan ki, yoxsa oğru? Ya əyrimisən ki, yoxsa doğru?* Xətayi. *Mollanın börkünü çalıb oğru; Yüyürüb qaçdı bir bağa doğru.* M.Ə.Sabir.

2. B a x **oğrun**. *Bu bir gözəllikdir qızlara. Yalnız; Oğru baxışlardan saqınmaq gərək.* S.Vurğun. ☐ **Oğru kimi** – gizlicə, xəlvəti, başqalarına sezdirmədən. *Oğru kimi içəri girmək. – Cuma .. öz evinə oğru kimi gəlmişdi.* Ə.Əbülhəsən.

**OĞRUBAŞI** *is.* Oğru dəstəsinin başçısı, oğrulara başçılıq edən adam. [Qulu:] *Bəli, Tehran həbsxanasından qaçmış oğrubaşı Səftərsən.* S.S.Axundov. *Zahirən Leylək zabitəli bir divanbəyi, içəridən bir oğrubaşı idi.* S.Rəhimov.

**OĞRU-ƏYRİ** *top.* Oğrular, oğurluqla məşğul olan adamlar, əli düz olmayan adamlar; cinayətkarlar. [Cındırlı kişi:] *Burada oğru-əyri çox olduğundan müştəriləri nərdivan ilə çıxardıb, sonra nərdivanı götürürük.* Ə.Haqverdiyev. *Çoxdan bəri əlinə oğru-əyri keçməyən milis müvəkkilinin gözləri parıldayırdı.* B.Bayramov.

**OĞRU-QULDUR** *top.* Oğurluqla, quldurluqla məşğul olan adamlar. *Leylək oğru-quldurun əzizi, iki gözü idi.* S.Rəhimov.

**OĞRUN** *zərf* və *sif.* Gizlicə, başqalarına sezdirmədən, başqalarına bildirmədən. *Ovçu görmüş maral kimi səksənib; Oğrun baxa-baxa bu yanə gəlsin!* Q.Zakir. *Səlimin oğrun baxışları Dilaranın xəyalından çıxmırdı.* M.İbrahimov.

**OĞRUNCA** b a x **oğrun**. *Oğrunca nəzər salmaq. – Nəbi kişi göz qapaqlarını qaldırıb tərs-tərs, ancaq oğrunca saqqalına dən düşmüş memara baxdı.* S.Rəhimov.

**OĞRUN-OĞRUN** *zərf* b a x **oğrun**. *Gəlinin başına bəy alma atır; Gəlin oğrun-oğrun baxıb naz satır.* Şəhriyar.

**OĞUL** *is.* 1. Kişi cinsindən olan övlad. *Onun oğlu olub. İki qızı, bir oğlu var.* – [Qurbanəli:] *Qaldır başını, sən axı Qurbanəlinin*

*oğlusan.* H.Nəzərli. *Son zaman Rüstəm kişi oğlunun tora düşməsində, pis bir günah işləməsindən qorxurdu.* M.İbrahimov.

2. Yaşlı adamın gənc oğlana nəvazişlə müraciəti. [Nisə xala:] *Oğul, siz şəhər adamısınız?* Qantəmir.

3. Əlindən iş gələn, iş bacaran adam haqqında. *Oğul ona deyərəm ki, bu işi görsün.*

**OĞULLUQ** *is.* 1. Oğulun ata-ana qarşısında borcu, vəzifəsi, haqqı; övladlıq. *Oğulluq borcu. Oğulluq etmək.*

2. Biri tərəfindən övladlığa götürülmüş, yaxud ana ardınca kişinin evinə gətirilən oğlan uşağı. ☐ **Oğulluğa götürmək** – doğma övlad hüququ verməklə oğlan uşağını ailəyə qəbul etmək. [Gülnisə Bəhrama:] *Mən səni əvvəldən özümə oğulluğa götürmüşəm..* C.Cabbarlı. [Ata:] *İdrisi oğulluğa götürmüşəm.* Mir Cəlal.

**OĞULSUZ** *sif.* Oğlan övladı olmayan, oğlu olmayan, yaxud oğlu ölmüş. *Oğulsuz analar yasa batmışdır.* S.Vurğun.

**OĞULSUZLUQ** *is.* Oğlan övladı olmayan ata-ananın halı, oğlu olmama.

**OĞUL-UŞAQ** *top.* Oğullar, qızlar bir yerdə. [Murad] *..evli və oğul-uşaq sahibi idi.* S.Hüseyn. [Cahan:] *Əsgər, gəl evlən, ev-eşik yiyəsi ol, oğul-uşaq sahibi ol..* Ü.Hacıbəyov.

**OĞURLAMA** "Oğurlamaq"dan *f.is.*

**OĞURLAMAQ** *f.* Başqasına məxsus şeyi, malı, pulu və s.-ni gizlincə götürüb mənimsəmək, aparmaq. [Odabaşı Xudayar bəyə:] *..Yekə kişi, xalqın eşşəyini oğurlayıb gətirmisən, qatmısan mənim karvansarama.* C.Məmmədquluzadə. [Dostəli:] *Bilmək olmur ki, onları kim oğurlayır.* Ü.Hacıbəyov.

**OĞURLANMA** "Oğurlanmaq"dan *f.is.*

**OĞURLANMAQ** 1. *məch.* Oğurluqla mənimsənilmək, aparılmaq, ələ keçirilmək. *Kassa oğurlandı.*

2. *f.* Gizli olaraq görmək, başqalarına sezdirmədən görmək (bir işi). [Tutu] *..adamlardan oğurlanıb birbaş Mürsəlin yanına gəlir..* Ə.Vəliyev.

**OĞURLATDIRMA** "Oğurlatdırmaq"dan *f.is.*

**OĞURLATDIRMAQ** *icb.* Başqası vasitəsilə oğurlatmaq, ələ keçirtmək. *O məlun kəbin verməmək üçün bu kağızı bizdən oğurlatdırmışdır.* M.S.Ordubadi.

**OĞURLATMA** "Oğurlatmaq"dan *f.is.*

**OĞURLATMAQ** *icb.* 1. Bir şeyi başqasının vasitəsilə xəlvəti əlinə keçirmək. [Xaqani:] *Bir yanda toy-büsat, bir yanda matəm; Şah qız oğurladır, rəzalətə bax.* M.Rahim.

2. Bir şeyin oğurlanmasına səbəb olmaq, başısoyuqluq, diqqətsizlik, sayıqsızlıq göstərərək bir şeyin oğurlanmasına imkan vermək. *Çamadanını oğurlatmaq.*

**OĞURLUQ** *is.* 1. Başqasının malını, şeyini, pulunu və s. oğurlama işi; oğrunun işi, peşəsi. *Oğurluqla məşğul olmaq. Oğurluq cinayətdir.* – [Şahbaz bəy:] *Adam aclığından, susuzluğundan oğurluğa, quldurluğa qurşanar.* M.F.Axundzadə. *Ömründə oğurluq etməyən muzdur bir neçə an fikir etdiyindən qəbih əməlin qəbahətini düşünməyə başladı.* S.M.Qənizadə.

2. Oğurlanmış. *Axşam satılan oğurluq maldan pristavın payı gətirilib qumar oynadığı yerdə özünə verildi.* Ə.Haqverdiyev.

**OĞURLUQCA** *zərf* Gizlicə, xəlvəti, başqalarına sezdirmədən. *Oğurluqca içəri girmək.* – *..Mən üç yüz evin kattası ola-ola bir ulağ da tapa bilmirəm, gedərəm oğurluqca özgələrin eşşəyini gətirrəm?* C.Məmmədquluzadə.

**OĞURSAQ** *is. məh.* Balası öldükdən sonra süd verən inək. *Oğursağı sağmaq.*

**OĞUZ** *is.* Göytürk imperatorluğu dövründə 9 tayfadan birini təşkil edən, bugünkü Azərbaycan və Türkiyə türkləri ilə yanaşı türkmən və qaqauzların da mənşəyində dayanan böyük bir türk boyu (tarixən oğuzların bir qolu boz-ok, ikinci qolu isə üç-ok adlanmışdır). *Oğuz boyları. Oğuzların məskəni. Oğuz adına ilk dəfə olaraq Yenisey abidələrində rast gəlinir. – Xanlar xanı xan Bayındır yildə bir kərrə toy edib, Oğuz bəglərin qonaqlardı.* "Dədə Qorqud".

**OH** *nida.* 1. Heyrət, təəccüb bildirir. *Oh, nə hündür ağacdır.*

2. Qorxu, ürək sıxıntısı bildirir, yaxud zəhmət və sıxıntıdan qurtardığına dəlalət edir. *Oh, canım qurtardı.* – [Səməd] *birdən beyninə hücum edən bu müdhiş sualın qarşısında donub qaldı, öz-özünə ucadan "oh!" – deyə bağırdı.* M.Hüseyn.

**OHA** *təql.* İnək, öküz və b. iribuynuzlu heyvanları hərəkətə gətirmək və ya hərəkətini

sürətləndirmək üçün çıxarılan səs. *Oha var dağa çıxarar; Oha var dağdan endirər*. (Məsəl). // İs. mənasında. *Yorulmuş öküz ohanı Allahdan istər*. (Ata. sözü).

**OHALAMA** "Ohalamaq"dan *f.is.*

**OHALAMAQ** *f.* "Oha" edərək inək, öküz və b. iribuynuzlu heyvanı hərəkətə gətirmək və ya hərəkətini sürətləndirmək. *Xaraba kəndin küçəsi ilə gələn bir qoca, qabağında gedən öküzü ohalayırdı*. Ə.Məmmədxanlı.

**OHO** *nida*. Gözlənilməz bir şey qarşısında təəccüb, heyranlıq, sevinc, yaxud tərif bildirir. [Səfər bəy:] *Oho, xoş gəlmişsən, xoş gəlmişsən, elə bu saat sənin fikrini eləyirdik ki, niyə hacı dərviş gəlməyir..* B.Talıblı. [Aslan Məzluma:] *Oho, lap qiyamətsən, pişiyimiz oğlan doğub*. S.Vəliyev.

**OX**[1] *nida*. 1. Təəssüf, məyusluq, peşmançılıq, narazılıq və s. hissləri ifadə edir. *Ox, bu nə işdir, elədim. Ox, başımız getdi. Ox, sənin əlindən hara qaçaq?* // Heyrət, təəccüb, heyranlıq, həsrət ifadə edir. [Pəri:] *Ox, belə bir gözəl oğlandan əl çəkmək olarmı?* C.Cabbarlı. // Sevinc, şadlıq, məmnunluq ifadə edir. *Ox, nə gözəl havadır. – Ox, bir ay sonra orası nə qədər gözəl olacaq*. A.Şaiq.

2. Nəvaziş, şəfqət, oxşama məqamında işlənir. *Ox, oğlum!* – [Qəhrəman:] *Ox!.. Mən o qədər gözəl, o qədər də qoçaq qız görməmişdim*. H.Nəzərli.

**OX**[2] *is.* 1. Yayla atılan itiuclu və ya ucuna iti dəmir keçirilmiş mil (qədim silah növü). *Oxu yaya qoymaq. Oxla ovu vurmaq. – Bunu fikirləşib, Koroğlu başçı durnaya bir ox atdı.* "Koroğlu". *Ox, kaman, qılınc və nizələr işlətməkdə ..* [mahir] *olan bu xalq əkin və torpaq işlərində də sənətkardır*. M.S.Ordubadi.

2. İstiqamət göstərmək üçün həmin mil şəklində işarə.

3. Maşının, mexanizmin və s.-nin hərlənən hissəsinin, habelə çarxın keçirildiyi mil, tir. *Avtomobilin oxu*. – [Rəşid:] *..Bir araba atını yıxılmış, ya bir arabanı oxundan və ya da çarxından sınan görsəydi,* [Qurbanqulu] *dərhal kömək edərdi*. T.Ş.Simurq. *Yolda evimizin yaxınında faytonumun çarxı oxdan çıxdı.* S.S.Axundov.

4. Mehvər. Yer kürəsinin oxu. *Planetlərin öz oxları ətrafında fırlanması.*

5. *xüs*. Hər hansı cismin simmetriya və ya ağırlıq mərkəzindən keçən düz xətt. *Təyyarənin oxu. Fırlanma oxu.*

◊ **Ox kimi** – 1) düz, düz istiqamətdə, düzünə. *Maşınlar çölləri, təpələri, yarğanları və ox kimi düz yolları arxada buraxaraq "Qızıl bayraq" kolxozuna yaxınlaşmaqda idi*. M.İbrahimov; 2) çox cəld, tez, sürətlə, güllə kimi. *Kəklik onun əlindən ox kimi çıxdı və bir anda meşənin yarpaqları arasında qeyb oldu.* A.Şaiq. **Ox kimi gözə batmaq** – tez-tez, daim, hər addımda görünmək, göz önündə olmaq (arzu edilməyən bir adam və ya şey haqqında). *Hər gün küçələrdə ox kimi gözə batan qorodovoy və qazaqlardan, əsər yox idi.* A.Şaiq. **Ox mənzili** – oxun və ya güllənin hədəfə dəyə biləcəyi məsafə. *Xana bir ox mənzili qalanda, Buğac atın üstündə dikəlib oxunu atdı..* M.Rzaquluzadə. **Oxu atıb yayını gizlətmək** – sözünü tam deməmək, fikrini yarımçıq söyləmək, əsil mətləbi üstüörtülü buraxmaq, deməmək. [Yusif:] *Pəri xanım, axı, gecə eyvanların altında gəzəni demədin, oxu atdın, yayını gizlətdin*. B.Bayramov. **Oxu daşa dəymək** – uğursuzluğa düçar olmaq, işi nəhs gətirmək. *Qurşunumuz keçməz boşa; Oxlarımız dəyməz daşa*. A.Şaiq.

**OXABƏNZƏR** b a x **oxvari**.

**OXALAMA** "Oxalamaq"dan *f.is.*

**OXALAMAQ** b a x **ovxalamaq**. [Yəhya Kamal] *..gözlərini oxalayıb bir də baxdı*. Mir Cəlal.

**OXALANMA** "Oxalanmaq"dan *f.is.*

**OXALANMAQ** b a x **ovxalanmaq**. *Mururizamanla oxalandı; Töküldü ehramların daşı.* O.Sarıvəlli.

**OXATAN**[1] *is. köhn.* Ox-kamanla silahlanmış əsgər.

**OXATAN**[2] (*lat.* Sagittarius) – Zodiak bürcü.

**OXAY** *nida*. Məmnunluq, sevinc, bir şeydən xoşlanmanı, bir şeyin cana yayıldığını bildirir. [Təlxək Əcinnəyə:] *Oxay! Canıma yayıldı..* Ə.Haqverdiyev. [Nəcəfalı Şahmara:] *Oxay, ay varım-dövlətim, əlin nə yaxşı sərindir.* B.Bayramov.

**OXDAN** *is. köhn.* Çiyindən asılan oxqabı, oxluq, sadaqa (dəridən və ya ağacdan olardı). [Qara Məlikin] *kamanı köhnə oxdanı sadə bir dəridən ibarət idi.* M.S.Ordubadi.

**OX-KAMAN** *top. köhn.* Ox və kamandan ibarət primitiv silah; ox-yay. *Elə ki, gün batdı, axşam oldu, Məlikməmməd qıvraq geyinib, ox-kamanını götürüb bağa getdi.* (Nağıl). *Qara Məlik vəliəhdin qəsdindən xəbərdar olduğu üçün qılıncını, ox-kamanını götürüb qaçaq düşmüşdü.* M.S.Ordubadi.

**OXQABI** b a x **oxdan**.

**OXLAMA** "Oxlamaq"dan *f.is.*

**OXLAMAQ** *f.* 1. Oxla vurmaq. *Ceyranı oxlamaq. – Yanaqların güldü, solmaz; Oxladın, yaram sağalmaz.* Aşıq Ələsgər.

2. *dan.* Ox keçirmək, ox salmaq (b a x **ox²** 3-cü mənada). *Arabanı oxlamaq.*

**OXLANMA** "Oxlanmaq"dan *f.is.*

**OXLANMAQ** *məch.* 1. Oxla vurulmaq. *İgidim oxlanıbdı; Ürəklər qara qandı.* (Bayatı).

2. *dan.* Ox keçirilmək, ox salınmaq (b a x **ox²** 3-cü mənada).

**OXLOV** *is.* Xəmir yaymaq üçün işlədilən ortası yoğun, ucları getdikcə nazikləşən taxta mildən ibarət alət. *Oxlovla xəmir yaymaq.*

**OXLOVÇU** *is. köhn.* Çörəkxanada xəmir yayan işçi. *Üzü pörtmüş şatır oxlovçunun verdiyi xəmiri .. təndirə yapırdı.* P.Makulu.

**OXLOVLAMA** "Oxlovlamaq"dan *f.is.*

**OXLOVLAMAQ** *f.* 1. Oxlovla yaymaq. *Xəmiri oxlovlamaq.*

2. Oxlovla döymək, oxlovla vurmaq. *Uşağı oxlovlamaq.*

**OXLU** *sif.* Oxu olan. *Oxlu təkər.*

◊ **Oxlu kirpi** *zool.* – gəmiricilər dəstəsindən kürəyi və yanları uzun tikanlarla örtülü məməli heyvan.

**OXLUQ** *is.* 1. Ox qayrılmaq üçün yarayan. *Oxluq ağac.*

2. B a x **oxdan**. *Şah oxluqdan bir ox alıb yaya qoyur.* A.Şaiq.

**ÓXRA** *is.* [*yun.*] Açıq qəhvəyi rəngli təbii boya.

**OXRANMA** "Oxranmaq"dan *f.is.*

**OXRANMAQ** *f. məh.* Yavaşdan kişnəmək. *At oxrandı.*

**OXRANTI** *is. məh.* Yavaş kişnəmə, kişnərti. *Oxrantı səsi.* – [Qoca:] *O yanda malın gövşəməsi, ilxının oxrantısı qulağıma gəlmir..* A.Divanbəyoğlu.

**OXŞADILMA** "Oxşadılmaq"dan *f.is.*

**OXŞADILMAQ** *f.* Bənzədilmək.

**OXŞAMA¹** "Oxşamaq¹"dan *f.is.*

**OXŞAMA²** 1. "Oxşamaq²"dan *f.is.*

2. *əd.* Azərbaycan şifahi xalq ədəbiyyatında lirik şeir formalarından biri. *Səhhət, Cabbarlı və Vurğun kimi sənətkarlarımız öz əsərlərində oxşamalardan ustalıqla istifadə etmişlər.*

**OXŞAMAQ¹** *f.* Bənzəmək. *Anasına oxşamaq. Bir-birinə oxşamaq.* – [Sona:] *Baxıram, siz çox yaxşı adama oxşayırsınız.* H.Nəzərli.

**OXŞAMAQ²** *f.* 1. Nəvaziş etmək, öz sevgisini, riqqətini ifadə etmək; nazlamaq. [Aslanın] *belə kövrəldiyini görən Gilə arvad nəvəsini qucağına alıb .. oxşamağa başladı.* Ə.Vəliyev. // Nəvaziş, sevgi, riqqət əlaməti olaraq əli ilə sığallamaq, əlini sürtmək. [Çoban:] *Bunun nə qədər ağıllı və igid heyvan olduğunu bilsən, heç vurmazsan, – deyə itin başını əlləri ilə oxşadı.* A.Şaiq. *Gəl, ipək saçını oxşayım! Səninlə bir an da yaşayım..* M.Müşfiq.

2. *məc.* Xoşlandırmaq, ləzzət vermək, ruhunu oxşamaq. *Xoş bir yel insanı oxşayır, köksünə sirli bir fərəh doldururdu.* Çəmənzəminli. *Xaçın çayı aşağı əsən sərin külək Nəcəfalı kişini oxşadı.* B.Bayramov.

3. Ölü üçün oxuyub ağlamaq. *Ölünü oxşamaq.*

**OXŞANMA** "Oxşanmaq"dan *f.is.*

**OXŞANMAQ** *məch.* Əzizlənmək, nəvaziş olunmaq, sevilmək, nəvazişlənmək. *Ana qucağında isinərkən, mehriban əllərlə oxşanarkən .. heç bir şey sənin üçün qorxulu deyil.* Mir Cəlal. *Sevildi, oxşandı o, məktəbdə də; Evdə olduğu tək ərköyün kimi.* B.Vahabzadə.

**OXŞAR** *sif.* Bənzər, oxşayan, bənzəyən. *Cəmiləyə oxşar bir ana öz toppuş qızı ilə oynayırdı.* S.Rəhimov. ..*Əndamlı xanım xalata oxşar, qırmızıgüllü, sarı paltar geymişdi.* M.İbrahimov. // Misl, bərabər. *Oxşarı yoxdur.* // *İs. mənasında.* Oxşarlıq, bənzəyiş, bənzərlik. *Məhəmməd Həsən əminin eşşəyinin itməkliyinin özgə eşşəklərin itməkliyinə bir tük qədər də oxşarı yoxdu.* C.Məmmədquluzadə.

**OXŞARLIQ** *is.* Bənzərlik, uyğunluq, bənzəyiş, oxşama. *Onların arasında heç bir oxşarlıq yoxdur.*

**OXŞATMA** "Oxşatmaq"dan *f.is.*

**OXŞATMAQ** *f.* 1. Bənzətmək. [Qulam müəllim] *Dəmirovu oxşatmışdı, ancaq tanıya bilməmişdi*. S.Rəhimov. *Qız yenə gülümsündü və bu təbəssüm onu məsum bir uşağa oxşatdı*. H.Seyidbəyli.

2. Yanılıb bir şeyi başqa bir şey zənn etmək, yanılıb bənzətmək. *Öz komandirinə oxşatmaq*.

**OXŞAYICI** *sif.* 1. Nəvazişli, şəfqətli, mehriban. *Oxşayıcı baxış*.

2. *məc.* Mülayim, yumşaq, sakit; ruhu oxşayan. *Gecənin sərin, oxşayıcı mehi* [Qədiri] *alıb ayrı aləmlərə apardı*. Mir Cəlal.

**OXŞAYIŞ¹** *is.* Bənzəyiş, oxşarlıq, bənzərlik. *Zahiri oxşayış*.

**OXŞAYIŞ²** *is.* Nəvaziş.

**OXŞƏKİLLİ** *sif.* Ox şəklində olan, ucu ox kimi iti olan; oxvari.

**OXŞƏKİLLİLİK** *is.* Oxşəkilli şeyin forması; oxvarilik.

**OXU** *is.* Hər hansı mətni səslə və ya səssiz oxuma; qiraət. □ **Oxu zalı** – kitab, qəzet və s. oxumaq üçün kitabxana, klub və s. yanında xüsusi otaq, zal; qiraətxana. *Oxu zalında məşğul olmaq*.

**OXUCU** 1. *is.* Kitab və s. oxuyan, mütaliəçi. *Yazıçılarla oxucuların görüşü. – İndi xəbər verim oxucuma mən; Xəyalı küsdürən bir faciədən*. S.Vurğun.

2. *is.* Kitabxanaya yazılmış adam, kitabxana üzvü, kitabxanadan istifadə edən şəxs. *Oxuculara nümunəvi xidmət. Oxucu bileti*. □ **Oxucu zalı** – b a x **oxu zalı** (“**oxu**”da).

3. *is.* Tutuşdurub yoxlamaq üçün orijinalı və ya əvvəlki korrekturanı korrektor üçün oxuyan adam, korrektor köməkçisi. *Oxucu vəzifəsi*.

4. *sif.* Oxuyan, ötən (quşlar haqqında). *Cəh-cəhə başladı oxucu quşlar; Dilləndi ağaclar, qarğı, qamışlar..* H.K.Sanılı.

**OXUDULMA** “Oxudulmaq”dan *f.is.*

**OXUDULMAQ** “Oxutmaq”dan *məch*.

**OXUMA** “Oxumaq”dan *f.is.* [Vahid:] *Lakin* [anamın] *oxuması ilə ağlamasını seçmək çətin idi*. B.Bayramov.

**OXUMAQ** *f.* 1. Yazılmış bir şeyi gözdən keçirib səslə və ya səssiz qiraət etmək, mütaliə etmək. *İngiliscə oxumaq*. – *Cənab Bax kağızı .. diqqətlə oxudu, sətirlərə təkrar-təkrar göz gəzdirdi, bir qüsur tapa bilmədi..* Çəmənzəminli.

2. Təhsil almaq, elm almaq, öyrənmək. *Universitetdə oxumaq. Texniki peşə məktəbində oxumaq*. – [Yusif:] *Mən on il bundan müqəddəm Şamdan bəy ilə bir yerdə oxumuşam*. N.Nərimanov. [Hacı] *oxumamışdır, amma avam da deyil*. Qantəmir. // Dərsi mənimsəmək, bilikləri, fənləri öyrənmək. *Pis oxumaq. Əlaçı oxumaq. – Cəlil hərçənd məktəbə gedib-gəlirdi, ancaq oxuduğu bir şey yox idi*. İ.Musabəyov. *Qız böyüdükcə yaxşı oxuyur, ədəbiyyata xüsusi meyil göstərirdi*. Ə.Əbülhəsən.

3. Mahnı və s. ifa etmək, bir şeyi hava ilə ifa etmək. *Xalq mahnıları oxumaq. Xorda oxumaq. – Rəqqasə ərəb qızları oynar və arasıra oxuyarlar*. H.Cavid. *Ürək kövrəkləşir sən oxuyanda; Sən də dinləsəydin mən oxuyanda!* M.Müşfiq.

4. Cəh-cəh vurmaq, civildəmək, ötmək (quşlar haqqında). *Bülbüllər oxuyur. – Artıq sübh açılan vaxtı maral sürüləri .. dağlara qalxmır, günəş doğanda kənd bağlarında quşlar oxumurdu*. Ə.Məmmədxanlı.

5. *məc.* Hiss etmək, sezmək, duymaq. *Qəlbini oxumaq. Baxışlarından oxumaq. – Oxuyuram yeni həyat sövdasilə çırpınan; Əksiliyə üsyan edən könülləri hər zaman*. M.Müşfiq. *Bir az əvvəl sən öz .. raportunu mənə oxuyarkən mən də sənin gözlərində başqa şeylər oxumuşdum*. Ə.Məmmədxanlı.

◊ **Meydan oxumaq** – b a x **meydan**.

**OXUMUŞ** *f.sif.* Təhsil almış, məktəb qurtarmış; təhsilli, savadlı. *Oxumuş qız*. – [Kətxuda] *bilirdi ki, İnmirə camaatının şəhərdə yaxşı iş bilən, oxumuş adamları vardır*. N.Nərimanov. // İs. mənasında. *Nə əhlimizdə ayıqlıq əlaməti görünəydi; Nə bir para oxumuşlarda bu zəkavət olaydı*. M.Ə.Sabir. *Kərim baba soyuq tövr ilə: – Bilmirəm bu oxumuşların səbri nə üçün az olur? Gəldiyiniz indidir, nə xəbər? – dedi*. A.Şaiq. // Çox mütaliə etmiş, geniş dünyagörüşü olan, bilikli, məlumatlı.

**OXUNAQLI** *sif.* Həvəslə oxunan, maraqlı. *Oxunaqlı kitab. – Məncə* “*Ana abidəsi*” *gərək faydalı, oxunaqlı bir roman olsun*. S.Rəhimov. // Asan oxunan, rəvan, səlis. *Əsərin oxunaqlı dili var*.

**OXUNMA** “Oxunmaq”dan *f.is.*

**OXUNMAQ** *məch.* 1. Gözdən keçirilərək səslə, ya səssiz qiraət edilmək. *Bu kitablar oxunub. – O biri namələr oxunanda çoxlu qəzetçi adları söyləndi.* Çəmənzəminli. *..Qış gecələrini bu ailə müharibə haqqındakı söhbətlərə, ya da bu barədə qəzetdən oxunanlara qulaq asmaqla keçirərdi.* Ə.Əbülhəsən.

2. Səslə mahnı və s. ifa edilmək. *Konsertdə yeni mahnılar oxundu. – Xüsusən oxuyanın ürəyəyatımlı səsi, oxunan bayatıdakı məna gözəlliyi sazın uyğun səsinə qarışdığı zaman alınan təsir daha da qüvvətlənirdi.* A.Şaiq.

3. *məc.* Hiss edilmək, sezilmək, duyulmaq. *Gözündən oxunmaq. Üzündən oxunmaq. – Həmişə* [Səmədin] *simasında dərin bir fikir, ya yüngül və şirin xəyalat oxunurdu.* Çəmənzəminli. [Mehribanın] *sürməyiyə çalan qara gözlərində həmişə kədər oxunur.* H.Seyidbəyli.

**OXUNUŞ** *is.* Oxuma işi, oxuma tərzi; oxunma. *Şerin oxunuşu. – Hamı ehtiramla fərmanın oxunuşunu dinlədi, sonra hərə öz ürək sözünü dedi.* S.Rəhimov.

**OXUŞMA** “Oxuşmaq”dan *f.is.*

**OXUŞMAQ** *qarş.* 1. Mahnı və s. oxumaqda yarışmaq; deyişmək. *Aşıqlar oxuşurlar. – ..Mən səsdə oxuyanı və mənim tək artisti indiyədək dünya yaratmayıb. Hər kəs xahiş edərsə, buyursun oxuşaq.* Ə.Haqverdiyev.

2. Səs-səsə verib oxumaq; civildəşmək, ötüşmək. *Quşlar gömgöy budaqlarda oturub oxuşurdular.* S.S.Axundov. *Meşənin tamam bülbülləri tarların səsinə cəm olmuşdular. Tar çalındıqca onlar da ağız-ağıza verib oxuşurdular.* Ə.Haqverdiyev.

**OXUTDURMA** “Oxutdurmaq”dan *f.is.*

**OXUTDURMAQ** “Oxumaq”dan *icb. Kağızı oxutdurmaq. – Hacı məktubu xanıma oxutdurmaq istəyirdi.* M.S.Ordubadi. [Səriyyə:] [Əmim] *9 il zəhmətimi çəkib oxutdurdu.* C.Cabbarlı.

**OXUTMA** “Oxutmaq”dan *f.is.*

**OXUTMAQ** *icb.* 1. Oxumağı xahiş etmək (başqasından), oxumağa sövq etmək, yaxud icazə vermək. *Pərinisə .. qardaşından təvəqqe elədi ki, kağızı aparıb bir adama oxutsun.* C.Məmmədquluzadə. // Oxumağı məsləhət görmək. *İndi mən bildim ki, kitabxanaçı; Neçin bu kitabı mənə oxutdu.* B.Vahabzadə.

2. Təhsil almasına kömək etmək, oxuyub təhsil almaq üçün məktəbə və s.-yə qoymaq. *Həsən ağanın pulu aşıb-daşır, uşaqlarını öz xərci ilə oxuda bilər.* Ə.Haqverdiyev. *Əri öləndən sonra Pəri istədi, molla tutub Nurunu oxutsun, lakin ərinin dedikləri yadına düşdü.* Ə.Vəliyev.

3. Dərs vermək, savad öyrətmək, müəllimlik etmək, tədris etmək. *Yaşlıları oxutmaq.* – [Sadıq:] *Xanların .. yoldaşıdır. Şəhərdə olur, uşaq oxudur.* Qantəmir.

4. Hava ilə bir şey oxumasını xahiş etmək, yaxud məcbur etmək. *Xanəndəni oxutmaq. Ariya oxutmaq.*

**OXUYAN** *is.* 1. Xanəndə. *Əntiqə indi nə oxuyur, nə də oxuyanlara yanaşırdı.* Mir Cəlal. *Ayna bulaqların ləzzəti varmı; Üstündə oxuyan, çalan olmasa?* N.Rəfibəyli.

2. Oxucu. *Bu təsəvvürdə olan oxuyanlar az deyil.* N.Nərimanov. *Mən* “*Həyat*”*ın cəmi oxuyanlarını gərək müjdə alıb xəbərdar edəm.* N.Vəzirov.

3. Savadlı, oxumuş mənasında. *Xanbibim falçı, nənəm bağtoxuyan; Bizdə haşa yox idi bir oxuyan!* M.Ə.Sabir.

**OXU-YAZI** *is.* 1. Oxuyub-yazmaqla məşğul olma, oxuma və yazma işi. *Vaxtını oxu-yazı ilə keçirmək.*

2. Oxuyub-yazmağı bacarma; savad. *Nadir vuruşmalar əsasında oxu-yazı öyrənib, biliyini artırmışdı.* B.Talıblı.

**OXUYUB-ÇALAN** *top.* Xanəndə və sazəndə, oxuyan və çalan, xanəndə və çalğıçı. *Toya oxuyub-çalan dəvət etmək.* – [Səfərqulu bəy:] *Ədə, oxuyan-çalanlara xəbər vermisənmi?* S.S.Axundov.

**OXUYUB-YAZMA** “Oxuyub-yazmaq”dan *f.is.*

**OXUYUB-YAZMAQ** *f.* Oxumaq və yazmaqla məşğul olmaq, zehni işlə məşğul olmaq. *Gecə-gündüz oxuyub-yazmaq.*

**OXVARİ** b a x **oxşəkilli**.

**OXYARPAQ** *is. zool.* Çayların sahillərində və ya bataqlıqda bitən ağ çiçəkləri və oxşəkilli yarpaqları olan ot bitkisi.

**OX-YAY** b a x **ox-kaman**.

**OKEÁN** [*yun.* okeanos – ucsuz-bucaqsız dəniz] Dünyanın bütün su ilə örtülü, yaxud onun materiklər arasındakı hissəsi. *Şimal Buzlu okeanı. Sakit okean.*

**OKEANÓQRAF** [*yun.*] Okeanoqrafiya mütəxəssisi.

**OKEANOQRAFİK** *sif.* [*yun.*] Okeanoqrafiyaya aid olan, okeanoqrafiya ilə bağlı olan. *Okeanoqrafik tədqiqat.*

**OKEANOQRÁFİYA** [*yun.* okeanos – ucsuz-bucaqsız dəniz və grapho – yazıram] Fiziki coğrafiyanın dəniz və okeanlarda gedən fiziki, kimyəvi, geoloji, bioloji prosesləri və hadisələri tədqiq edən sahəsi.

**OKSİD** *is.* [*yun.*] Kimyəvi elementlərin oksigenlə birləşməsi.

**OKSİGÉN** [*yun.* oxys – turş və genos – əmələ gətirən] Havanın tərkibinə daxil olan, tənəffüs və yanmaq üçün zəruri olan, hidrogenlə birləşdikdə su əmələ gətirən rəngsiz və iysiz qaz – kimyəvi element. ◻ **Oksigen balışı (yastığı)** – içi oksigenlə doldurulmuş kisəcik (xəstələrin oksigenlə nəfəs alması üçün).

**OKTAEDR** [*yun.* okta – səkkiz və hedra – üz] *riyaz.* Səkkiz səthdən ibarət fiqur; səkkiztərəfli.

**OKTÁVA** [*lat.* octava – səkkizinci] *mus.* 1. Qammanın səkkizinci pilləsi, habelə müxtəlif yüksəklikdə olan ən yaxın eyniadlı səslər arasındakı interval.

2. Ən alçaq bas səsi.

**OKTYÁBR** [*lat.* october, octo – səkkiz] Təqvim ilinin onuncu ayı. *Oktyabr döyüşləri. Mübarizə oktyabrın 20-də üsyançıların tam məğlubiyyəti ilə qurtardı. Oktyabr ayı Cavidlər ailəsinin ayıdır.*

**OKULİST** [*lat.* oculis – göz] Göz xəstəlikləri mütəxəssisi olan həkim.

**OL** "O" işarə əvəzliyinin klassik dildə işlədilən forması. *Eşq əhlinə ol mah, Füzuli, nəzər etmiş; Sən həm özünü göstər, əgər bir hünərin var.* Füzuli. *Ol gün ki, sənə xaliq edər lütf bir övlad; Olsun ürəyin şad!* M.Ə.Sabir.

**OLACAQ** *is.* 1. Tale, alın yazısı, labüd şey. [Mahmud bəy:] *Olacağa çarə yoxdur, hacı!* N.Vəzirov.

2. İçində yaşamaq üçün yer (mənzil, ev və s.). [Alı Rövşənə:] *İndi özümüzə bir olacaq, atlarımıza da bir tövlə tik.* "Koroğlu".

**OLAN-QALAN** *sif. dan.* İşlədildikdən, sərf olunduqdan sonra qalan. [Qurban:] *Olan-qalan pul da bir otuz manat olardı, toya xərc olundu, getdi.* Ə.Haqverdiyev. *Samovarda olan-qalan su axıb qurtardıqdan sonra içindəki od samovarın özünü yandırıb odluğunu çıxarardı.* H.Sarabski. // *İs. mənasında.* İşlədildikdən, sərf olunduqdan sonra qalan pul, şey və s. [Oğlan] *odur ki, olan-qalanını dəyər-dəyməzinə satmağa başladı.* S.Rəhman.

**OLAN-OLMAZ** *sif. dan.* Hər nə var, mövcud. *Olan-olmaz yem ehtiyatı tükəndiyindən qışda zəif düşmüş heyvanın saxlanması daha da çətinləşirdi.* B.Bayramov. // *İs. mənasında.* Qalan-qalmaz, mövcud olan, qalmış olan pul, şey və s. *Aslan bütün olan-olmazını xərcləmişdi.* C.Cabbarlı. [Səfər kişi:] *Yağınlıq olmadı, el düşdü dərdə; Olan-olmazı da məhv etdi dolu.* S.Rüstəm.

**OLAY** *is.* Hadisə, əhvalat.

**OLDUQCA** *sif.* Çox, xeyli, lap çox, həddən artıq. *Olduqca mürəkkəb məsələ.* – [Mehriban] *xüsusilə çocuğu doğduqda olduqca ağır və böhranlı hallar keçirmişdi.* S.Hüseyn. *Gün olduqca isti idi.* Ə.Vəliyev.

**OLEÁNDR** [*fr.*] Xoşiyli qırmızı, al və ya ağ gülləri olan həmişəyaşıl kol bitkisi; söyüdgülü. *Oleandr və ya söyüdgülü .. geniş becərilən bəzək bitkisidir, yarpaqları dəstə halında üç-üç düzülür.* M.Qasımov.

**OLİQARXİYA** [*yun.* oligarchia] 1. Qədim və orta əsrlərdə: cəmiyyətin zadəganlardan ibarət yuxarı təbəqəsinin əsasında qurulan dövlət üsulu, habelə hakimiyyət sürən bu qrupun özü.

2. *məc.* İri inhisarçı kapitalın nümayəndələrindən ibarət kiçik bir qrupun siyasi və iqtisadi hakimiyyəti. *Maliyyə oliqarxiyası.*

**OLİMP** [*yun.* dağ adı] *mif.* 1. Qədim yunan əsatirində: allahların məskəni, habelə yığışdığı yer.

2. Bax **olimpiya**. *Olimp oyunları.*

**OLİMPİADA** [*yun.* olympias (olympiados)] 1. Qədim Yunanıstanda: olimpiya oyunları bayramları arasındakı dörd ildən ibarət təqvim vahidi.

2. Dörd ildən bir keçirilən beynəlxalq idman yarışları.

3. İdman, teatr və s. yarışları. *Bədii özfəaliyyət olimpiadası.*

4. Məktəblilər arasında ayrı-ayrı fənlər üzrə konkret tapşırıqları yerinə yetirmək üzrə

yarış; məs.: riyaziyyat, biologiya, kimya, fizika və s.

**OLİMPİYA** [*yun.*]: **olimpiya oyunları** – qədim Yunanıstanda: Zevs adlı allahın şərəfinə Olimpiya yaxınlığında hər dörd ildən bir keçirilən ümumxalq oyunları, habelə idmanın bütün növləri üzrə keçirilən müasir beynəlxalq yarışlar.

**OLİMPİYAÇI** *is.* Olimpiya yarışlarında iştirak edən idmançı. *Olimpiyaçıların müvəffəqiyyətləri*.

**OLMA** "Olmaq"dan *f.is. Havaların isti olmasına baxmayaraq, qalın ipək parça və məxmər paltar geymiş* [xanım] .. *kölgəyə çəkilmək istəmirdi.* P.Makulu.

**OLMAQ** 1. Müstəqil feil kimi aşağıdakı mənalarda işlədilir: a) yaşamaq, sakin olmaq, ömür sürmək. *İki il Bakıda oldum. O, yataqxanada olur. Siz hansı küçədə olursunuz? – Mərcan xanım uzaqda olmurdu.* T.Ş.Simurq; b) mövcud olmaq, var olmaq. *İnsan olmasaydı nəyə gərəkdi; Sənin gözəlliyin, ana təbiət!* M.Dilbazi; c) iştirak etmək. *Dərsdə olmaq. Qonaqlıqda olmaq. İclasda olmaq;* ç) üz vermək, baş vermək, vaqe olmaq, əmələ gəlmək. *Dünən balaca yanğın olmuşdu. – Azad çırpınacaq bütün vicdanlar; Nə hicran olacaq, nə də intizar.* S.Vurğun. *Qonşu, yenə nə olub? – deyə soruşdum.* S.Rüstəm; d) doğulmaq, dünyaya gəlmək, anadan olmaq. – *Onun nəyi olub? – Bir qızı olub. Uşaqlar ekiz olub. – ..Münəvvər xanımın binadan-başdan uşağı olmurdu.* Mir Cəlal. *Cavadla Zöhrə Aslan olandan sonra bir-birini daha da çox sevməyə başladılar.* Ə.Vəliyev; e) bir yerə gəlmək (getmək), bir yeri gedib görmək. *Saat ikidə məktəbdə olacağam.* – [Maya] *hələ ömründə çobanların yaşadığı alaçıqda olmamışdı.* M.İbrahimov; ə) yerləşmək, sığmaq. *Şeylər çamadana olmur. Papaq başına yaxşı oldu;* f) malik olmaq. *Pulu olmamaq. Bağı olmaq. Maşını olmaq. – Cəmi yeddiillik təhsili olan Gülaçar qızğın mütaliə həvəskarı idi.* İ.Əfəndiyev; g) mümkün olmaq, icazə verilmək. *Gəlmək olarmı? İçəri girmək olar;* ğ) bir haldan başqa hala keçilmək, dəyişmək. *Su donub buz oldu. Od sönüb kül oldu.* – [Gilənin] *axşamdan basdırdığı qaratikan kötüyü lülə köz olmuşdu.* Ə.Vəliyev; h) gəlib çatmaq, yetişmək. *Səhər oldu. Gecə yarı oldu. – Bayram oldu, heç bilmirəm neyləyim? Bizim evdə axta zoğal da yoxdur*. M.P.Vaqif. *Axşam hələ olmamışdı.* S.Hüseyn.

2. Köməkçi feil kimi işlədilir: a) ixtisas və sənət mənası verən isimlərdən sonra gələrək, həmin ixtisas və sənətə yiyələnməyi, onunla məşğul olmağı bildirir. *Müəllim olmaq. Həkim olmaq. – Firəngistanda birisi ki istəyir alim ola, gərək gecələr yatmayıb zəhmət çəkə, elm oxuya*.. C.Məmmədquluzadə; b) isim, sifət və saylardan sonra gələrək həmin sözlərdən *-lan* // *-lən* və *-laş* // *-ləş* şəkilçilərinin əlavəsilə düzələn feillərin sinonimləri olan mürəkkəb feillər əmələ gətirir; məs.: xəstə olmaq (xəstələnmək), yaxşı olmaq (yaxşılaşmaq), qoşa olmaq (qoşalaşmaq), yoxsul olmaq (yoxsullaşmaq), şən olmaq (şənlənmək); c) bir sıra sözlərdən sonra gələrək mürəkkəb feil və ifadələr düzəldilir; məs.: bənd olmaq, xaraba olmaq, daxil olmaq, aşiq olmaq.

3. **Oldu!** şəklində – tabe şəxsin, verilən əmri, tapşırığı başa düşdüyünü və onu dərhal icra edəcəyini bildirən cavabı; baş üstə!

◊ **Olan oldu (olub)** – olub keçmiş, düzəlməsinə, islahına vaxt, imkan olmayan hadisə haqqında. **Olan oldu, keçən keçdi** – keçmiş ola, artıq gecdir, keçənə güzəşt deyərlər. *Onlar deyən yalan oldu; Keçən keçdi, olan oldu.* M.Müşfiq. *Yaxşı, olan oldu, keçən də keçdi; İndi fikrin nədir, de görək indi?* S.Vurğun. **Ay oldu ha!** – işin baş tutmayacağını bildirmək üçün işlədilən istehzalı ifadə. **Bir dəfə (kərə) də olsun** – heç, qətiyyən, əsla, tamamilə. *Bir dəfə də olsun işə gecikməyib. – Mirzağa elmi tənəzzöhlərə, səyahətlərə bir kərə də olsun getməmişdi.* S.Hüseyn. **(Bu) olmadı** – bir fikir və ya təkliflə razılaşmadıqda etiraz ifadəsi kimi işlədilir. *Bu olmadı, o bizim ən yaxşı operatorlarımızdandır*. **Hər necə (cür) olursa olsun** – 1) heç bir şeyə baxmayaraq. *Hər necə olursa olsun getməlisən*. – [Kor Seyid] *hər necə olursa olsun arvadını aparacağını söyləyirdi.* S.Hüseyn; 2) b a x **hər necə olsa**. **Hər necə olsa** – hökmən, mütləq, heç bir şeyə baxmayaraq. [Tubu:] *Qızım, dəli olma, Həsən hər necə olsa, sənin atandır. Ona niyə kömək eləməyəsən?* Ə.Haqverdiyev.

**OLMALI** *sif.* Olması, həyata keçirilməsi, varlığı, iştirakı lazım sayılan, arzu edilən, istənilən. *Bu gün işdə olmalısan.*

**OLMAYA** 1. "Bəlkə", "yoxsa" mənalarında ara söz. *Olmaya, sən də bu fikirdəsən. Olmaya, onun da könlündən keçir. – Olmaya, sən məni biiqrar sandın; Zarafat eylədim, ona inandın.* M.P.Vaqif. [Hambal:] *Məşədi, olmaya, oğurluğa gedirsən?* Ü.Hacıbəyov.

2. B a x **olmaya-olmaya**. *Olmaya, ora gedəsən!*

**olmaya-olmaya** *zərf* 1. Bir işin icrasının qəti surətdə məsləhət görülmədiyini, tövsiyə edilmədiyini, bir işdən saqındırmağı bildirir; məbada. *Olmaya-olmaya gedəsən!* – [Tağı əmi:] *..Atı yavaş sür. Olmaya-olmaya çapasan.* S.S.Axundov.

2. Olmadığı halda, olmadığına baxmayaraq. *Vaxtı olmaya-olmaya söz verir.*

**OLMAZ** 1. İmkan yoxdur, mümkün deyil. *Qidasız yaşamaq olmaz. Razı olmamaq olmaz.*

2. İcazə yoxdur, qadağandır, yaramaz. *İcazəsiz içəri girmək olmaz. Metroda papiros çəkmək olmaz.* // Yaxşı deyil, ayıbdır, qeyri-mümkündür. *Belə söz demək olmaz. Cavab qaytarmaq olmaz.*

**OLMAZIN** *sif.* 1. Son dərəcə, həddən artıq, ölçüyəgəlməz, görünməmiş. *Olmazın əziyyət. Olmazın ziyan. – Qazamat qulluqçuları Həcərə olmazın əziyyətlər verirlər.* "Qaçaq Nəbi". [Məsmə:] [Ərimi] *xəstəxanaya yerləşdirmək üçün olmazın əmək sərf etdim.* S.Hüseyn.

2. Yolverilməz, namünasib, nalayiq, yaraşmaz. *Olmazın söz. – Lakin bir saatdan bəri hamı ağzına gələni danışmaqdan və olmazın şeyləri eşitməkdən yorulmuşdu.* Ə.Əbülhəsən.

3. Mümkün olmayan, ola bilməyən, baş verə bilməyən. [Müşavir:] *Dünyada olmazın iş yoxdur.* P.Makulu.

**OLSA-OLSA** *ara s.* Ancaq, ancaq-ancaq, ciddi qiymət verilərsə, ən çoxu. [Firəngiz:] *Olsa-olsa* [Muxtar] *səhv etmişdir, işin mahiyyətini başa düşməmişdir.* B.Bayramov.

**OLSUN** 1. Yaxşı, razıyam, etirazım yoxdur. – *Olsun, – deyə direktor gülümsündü.*

2. "Ki" bağlayıcısı ilə: **olsun ki**... – ola bilsin ki..., ola bilər ki..., mümkündür ki..., yəqin, ehtimal ki..., bəlkə də... *Olsun ki, o bu təklifi qəbul etməsin.*

**OLUB-KEÇƏN** *is.* Olmuş əhvalat, keçmiş məsələ, vaqiə, iş, hadisə. *Olub-keçənləri yada salmaq. – ..Qadirlə əmisi .. olub-keçəni daha yaxşı başa düşürlərmiş kimi, gözlərini bir-birindən çəkmirdilər.* Ə.Əbülhəsən. *O vaxt olub-keçəni gətirib bir-bir yada; Mən söhbət açacağam əsgərlikdən, davadan.* Ə.Cəmil.

**OLUB-KEÇMİŞ** *sif.* Olmuş, olub-bitmiş, baş vermiş, keçmiş. *Olub-keçmiş əhvalat.* – [Gülnaz] *olub-keçmiş hadisələri xatırlamamaq üçün başqa şey haqqında fikirləşirdi.* Q.İlkin.

**OLUNMA** "Olunmaq"dan *f.is.*

**OLUNMAQ** "Olmaq"dan *məch. İdarə olunmaq. Azad olunmaq. Təşkil olunmaq. Təklif olunmaq.*

**OLUŞ** *is.* Kürəkayaqlılar fəsiləsindən bədəni və qanadları ağ iri quş.

**OM** [*xüs. is.*-dən] Elektrik müqaviməti vahidi.

**OMAÇ** *is.* Su səpilmiş unun ovuntularından bişirilən duru xəmir xörəyi.

**OMAR** *is.* Onurğasız dəniz heyvanı; onayaqlı xərçəng.

**OMBA** *is. anat.* Qıçın çanaqdan dizə qədər olan hissəsi.

**OMÉQA** [*yun.* omeqa – böyük o] Yunan əlifbasının son hərfinin adı (ω).

**OMLET** *is.* [*fr.*] Su və ya süddə çalınmış yumurta yeməyi; qayğanağın bir növü.

**OMONİM** [*yun.* homo – eyni və onyma – adlı] *dilç.* Eyni cür səslənən, lakin mənaca fərqlənən sözlərdən hər biri (məs.: alıcı – müştəri və alıcı – ovçu quş).

**OMONİMİK** *sif.* [*yun.*] *dilç.* Omonim olan. *Omonimik sözlər.*

**OMONİMİKA** [*yun.*] *dilç.* 1. Hər hansı bir dildəki omonimlərin məcmusu.

2. Leksikologiyanın omonimləri öyrənən bölməsi.

**OMONİMÍYA** [*yun.*] *dilç.* Mənaca müxtəlif olan sözlərin səslənmə cəhətdən bir-birinə uyğun gəlməsi.

**ON** *say.* 1. Doqquzdan sonra gələn ədəd – 10.

2. On birdən on doqquza qədər mürəkkəb sayların birinci tərkib hissəsi.

**on-on** *zərf* Hər dəfə on dənə, hər adama on dənə, yaxud hər dəstədə on nəfər. *On-on sıraya düzülmək.*

**ONALTILIQ** *is. ədəb.* Hər misrası on altı hecadan ibarət olan şeir ölçüsü.

**ONATILAN, ONAÇILAN** *is. dan.* Xəzinəsi on patron tutan tüfəng və ya tapança. [Həcər xanım] *onaçılan tapança götürər, kişi kimi gəzərdi.* "Aşıq Ələsgər". *Onların yanında yağlı bir nağan; Onun da altında bir onaçılan.* S.Vurğun. [Hacı:] *Onatılana gəlincə, sənin leşini on kərə yerə sərərlər, gədə!* P.Makulu. // Sif. mənasında. *Onatılan tüfəng.*

**ONAYLIQ** *sif.* 1. On ay üçün düzəldilmiş, on aylıq müddət nəzərdə tutulmuş, yaxud on ay ərzində olmuş. *Onaylıq hesabat. Onaylıq kurs.*

2. Yaşı on ay olan. *Onaylıq uşaq.*

**ONBAŞI** *is.* 1. Fəhlə qrupuna başçılıq edən adam.

2. *köhn.* On nəfərə başçılıq edən əsgər; yefreytor.

**ONBAŞILIQ** *is.* Onbaşı rütbəsi, vəzifəsi.

**ONBEŞLİK** *is.* 1. *ədəb.* Hər misrası on beş hecadan ibarət olan şeir.

2. On beş nömrəli, on beş vahiddən ibarət (ölçü, ya şey). *Onbeşlik lampa. Onbeşlik taxta.*

**ONBİRİLLİK** *is.* Təhsil müddəti on bir il davam edən, on bir il sürən məktəb. *Onbirilliyi bitirmək.* // Sif. mənasında. *Onbirillik məktəb.*

**ONBİRLİK** *is. ədəb.* Hər misrası on bir hecadan ibarət olan şeir ölçüsü.

**ONBUCAQ(LI)** 1. *is.* On bucağı olan həndəsi cisim, onkünclü cisim.

2. *sif.* On bucağı olan. *Onbucaqlı fiqur.*

**ONCA** *sif.* Ancaq on, yalnız on. *Onca qəpik pulum qalıb.* // Bəzən təyin etdiyi sözə böyüdücülük çaları verir. *Niyə xoşun gəlmir, onca manata almışam.*

**ONDA** *zərf* 1. İndi yox, o zaman, o vaxt. *Gələrəm, onda danışarıq. – Bir xəlvət yer ola, əğyar olmaya; Onda söhbət edək ikimiz belə.* M.P.Vaqif.

2. Elə isə, o halda, elədə. *Onda düz demirsən. Onda görərsən.*

**ONDÖRDLÜK** *is. ədəb.* Hər misrası on dörd hecadan ibarət olan şeir ölçüsü.

**ONGİRVƏNKƏLİK** *sif. köhn.* On girvənkə ağırlığında olan. *Ongirvənkəlik daş.* // *is.* On girvənkə ağırlığında olan çəki daşı. *Ongirvənkəliyi tərəzinin gözünə qoymaq.*

**ONGÜNLÜK** 1. *sif.* On gün sürən, on gün davam edən, yaxud on gün vaxt tələb edən. *Ongünlük möhlət. Ongünlük yol. Ongünlük iş.* // On günə çatan, kifayət edən. *Ongünlük azuqə. Ongünlük ehtiyat.*

2. *is.* Bir şeyə həsr olunmuş on gün; dekada. *Moskvada Azərbaycan incəsənəti ongünlüyü.*

**ONİKİBARMAQ: onikibarmaq bağırsaq** *anat.* – nazik bağırsağın mədədən başlanan hissəsi (köndələninə on iki barmaq uzunluğunda olduğundan belə adlandırılmışdır).

**ONİKİLİK** *is. ədəb.* Hər misrası on iki hecadan ibarət olan şeir ölçüsü.

**ONİLLİK** *sif.* 1. On il sürən, on il müddətli, on il davam edən. *Onillik xidmət.* // On il müddətinə tərtib olunmuş, on ili nəzərdə tutan. *Onillik plan.*

2. Təhsil müddəti on il davam edən. *Onillik məktəb.* – [Rəhim:] *Mən müharibədən əvvəl Bakıda dövlət konservatoriyası yanında onillik musiqi məktəbində oxuyurdum.* Ə.Sadıq. // *is.* Təhsil müddəti on il davam edən tam orta məktəb. *Onilliyi qurtarmaq. Onillikdə oxumaq. – Onillikdən sonra* [Nəcəf] bir *müddət kolxozda işlədi..* M.İbrahimov.

3. On yaşında olan, onyaşar. *Onillik ağac.*

4. On ildən qalma, on il ömrü olan. *Onillik konyak.*

5. *is.* On ildən, əsrin onda birindən ibarət vaxt hesabı. *XX əsrin birinci onilliyi. – Vaxt hesabında hər on il – bir onillikdən, hər yüz il – bir əsrdən, hər min il – bir minillikdən ibarətdir..* "Qədim dünya tarixi".

**ONKOLÓGİYA** [*yun.* onkos – kütlə, şiş və logos – elm] Tibbin, şişlərin əmələgəlmə səbəbini, inkişafını, klinik gedişini, müalicə və profilaktikasını öyrənməklə məşğul olan sahəsi.

**ONKOLOJÍ** *sif.* [*yun.*] Onkologiyaya aid olan, onkologiya ilə əlaqədar olan. *Onkoloji tədqiqat. Onkoloji institut.*

**ONKÓLOQ** [*yun.*] Onkologiya mütəxəssisi, həkim.

**ONKÜNC(LÜ)** b a x **onbucaq(lı)**.

**ONQAT(LI)** *sif.* 1. On mərtəbə(li). *Onqatlı ev.*

2. Bir-birinin üzərində on lay olan. *Onqatlı kordon.*

**ONQƏPİKLİK** *sif.* On qəpiyə dəyən, on qəpik qiymətində olan. *Onqəpiklik marka.* // *is.* İkişahılıq metal pul.

**ONQRAMLIQ** *is.* On qram ağırlığında olan (daş və s.). *Onqramlıq daş.*

**ONLAR** [üçüncü şəxs əvəzliyinin cəmi] Haqqında danışılan və ya göstərilən şəxsləri bildirir. *Onlar getdilər. – Qurbanəli onlara başçılıq edir.* H.Nəzərli. *Onlar sevinirdilər, çünki hər ikisinin dərs və əxlaq qiymətləri əla və yaxşı idi.* M.Rzaquluzadə.

**ONLARLA, ONLARCA** *sif.* Sayı bir neçə on olan; çox, çoxlu. *Onlarla adam. – Onlarca əllərin zərbəsi ilə parçalanmağa başlayan divar, .. yanğını keçirmək istəyənlərə mane olurdu.* Ə.Əbülhəsən. *..Ov edərkən arxamızca, yan-yörəmizcə onlarca göz baxır, bizi izləyirlər.* M.Rzaquluzadə.

**ONLUQ** *sif.* 1. Onmanatlıq, on manat dəyərində olan. *Aşıq Ələsgər belə deyəndə Məşədi Yolçu əlini salıb, cibindən bir onluq qızıl çıxartdı..* "Aşıq Ələsgər". // *is.* Onmanatlıq, on manat qiymətində olan pul. *Kələntər əlini şalvar cibinə salıb əzilmiş bir onluq çıxartdı.* M.İbrahimov. *Onluqdan tutmuş yüzlüyə qədər pullar sazın üstünə xəzəl kimi töküldü.* B.Bayramov.

2. Lampada işıq, taxtada qalınlıq dərəcəsini bildirir. *Onluq taxta. – Buxarının üstündəki mıxa onluq lampa keçirilmişdi.* M.Hüseyn. [Hümmət] *stolun üstünə qoyulmuş şüşəsi hisli onluq lampanı yandırdı.* B.Bayramov. // On xalı olan. *Onluq kart.* // İs. mənasında. [Nəbi:] *Odur ki, bu gecə on bir əl dalbadal onluğa vuruldu.* S.S.Axundov.

3. *ədəb.* Hər misrasında on heca olan. *Onluq şeir.*

◊ **Onluq kəsr** *riyaz.* – məxrəci on, yüz, min və s. rəqəmlərdən ibarət olan kəsr. *Onluq kəsrləri toplamaq.* **Onluq say sistemi** – əsasını onluq(lar) təşkil edən, onluqlardan ibarət say sistemi. *Hazırda insanlar onluq say sistemindən istifadə edirlər.* Z.Xəlilov.

**ONMANATLIQ** *is.* On manat qiymətində olan kağız pul; onluq. *Onmanatlığı xırdalamaq.* // *sif.* On manata dəyən, on manat qiymətində olan. *Onmanatlıq parça.*

**ONMƏRTƏBƏ(Lİ)** *sif.* On mərtəbəsi olan; onqat(lı). *Onmərtəbəli bina.*

**ONMİNLİK** *sif.* Sayı on min olan, on min nəfərdən ibarət olan. *Onminlik qoşun.*

**ONOMÁSTİKA** [*yun.* onoma – ad] 1. Dildə mövcud olan xüsusi adların hamısı.

2. Dilçiliyin xüsusi adları öyrənən bəhsi.

**ONOTAQLI** *sif.* On otağı olan, on otaqdan ibarət olan. *Onotaqlı kənd xəstəxanası.*

**ONSİNİFLİ** *sif.* On sinfi olan. *Onsinifli məktəb.*

**ONTONLUQ** *sif.* On ton yük və s. tutan. *Ontonluq avtomobil.* // On ton ağırlığında olan. *Ontonluq yük.*

**ONUNCU** "On"dan *sıra s. Onuncu sinif. Onuncu adam. Onuncu sıra.*

**ONURĞA** *is. anat.* Bel sümüyü.

◊ **Onurğa beyni** – onurğa kanalının içərisindəki ilik; haram ilik.

**ONURĞALI** *anat.* 1. *sif.* Onurğası olan.

2. *cəm.* **Onurğalılar** şəklində – onurğalı heyvanlara verilən ümumi ad; onurğalı heyvanlar.

**ONURĞASIZ** *anat.* 1. *sif.* Onurğası olmayan. *Onurğasız heyvan.*

2. *cəm* **Onurğasızlar** şəklində – onurğasız heyvanlara verilən ümumi ad; onurğasız heyvanlar.

**ONYAŞAR** *sif.* On yaşı olan. *Onyaşar heyvan.*

**ONYAŞLI** *sif.* On yaşı olan. *Onyaşlı şagird.*

**ONYERLİ** *sif.* On adamlıq yeri olan. *Onyerli avtobus.*

**OPÁL** [*lat.*] Bəzi növləri qiymətli sayılan şəffaf şüşəvari daş.

**ÓPERA** [*ital.*] 1. Teatrda ifa olunmaq üçün instrumental musiqili dram əsəri, habelə iştirak edən şəxslərin əsərin sözlərini musiqinin müşayiəti ilə (hava ilə) söylədikləri teatr tamaşasının özü. *Hüseynqulunun bəxtini bir şey açdı ki, məşhur musiqişünas Üzeyir bəy Hacıbəyov "Leyli-Məcnun" adında bir opera yazdı.* S.Rəhman.

2. Bu cür əsərlərin tamaşaya qoyulduğu teatr binası. *Bu gün operada nə gedir?* – [Şirin] *tez-tez operaya gedirdi.* İ.Əfəndiyev.

**OPERÁSİYA** [*lat.* operatio – təsir] Bəzi xəstəliklər, yaxud yaralanmalar zamanı müalicə məqsədilə icra edilən cərrahlıq əməliy-

yatı. *Zeynal gözlərinin tezliklə operasiya olunmasını tələb edirdi.* B.Bayramov. // *dan.* Cərrahlıq əməliyyatı vasitəsilə bədənin bir üzvü və ya hissəsinin kəsilib götürülməsi. *Kor bağırsağın operasiyası.*

**OPERATİV** *sif.* [*lat.*] 1. Hərbi əməliyyata aid olan. *Operativ plan. Operativ məlumat.*

2. Bir işi bilavasitə, əməli surətdə həyata keçirən, görən. *Operativ qrup. Operativ şöbə. Operativ orqanlar.*

3. İşin gedişini tez qaydaya salan, düzəldən, yoluna salan, düzgün istiqamətə yönəldən. *Operativ göstəriş. Operativ rəhbərlik.*

**OPERATİVLİK** *is.* Operativ olma (b a x **operativ** 2-ci mənada).

**OPERÁTOR** [*lat.*] 1. *xüs.* Mürəkkəb mexanizmlərin işini idarə edən və ya müəyyən istehsal prosesinin icrasına cavabdeh olan yüksək ixtisaslı fəhlə. [Nailə Mansurova:] *Gedək operator otağına, sabun, məhrəba verim, üzünüzü yuyun.* H.Seyidbəyli. // Nəqliyyatda: dispetçerin göstərişlərini qəbul edən və hərəkət haqqında ona məlumat verən işçi.

2. Filmin yaradıcılarından biri, filmi çəkən şəxs.

**OPERATORLUQ** *is.* Operatorun işi, vəzifəsi.

**OPERÉTTA** [*ital.*] Oxumaq, rəqs və danışmaqla əlaqələndirilən gülməli musiqili səhnə əsəri. *Ü.Hacıbəyovun operettaları. – Ümumiyyətlə, operetta çox gözəl təsir bağışlayırdı.* İ.Əfəndiyev. // Həmin əsərlərin səhnədə tamaşaya qoyulduğu teatr.

**OPPONÉNT** [*lat.* opponentis – etiraz edən] Mübahisədə, müzakirədə, disputda və s.-də birinin fikrinə, dəlilinə, mülahizəsinə etiraz, yaxud onları təkzib ilə çıxış edən şəxs. *Opponentə cavab vermək. – Sədr ayağa qalxıb deyir: – Opponentlər qurtardı. Çıxış etmək istəyən varmı?* Q.İlkin. □ **Rəsmi opponent** – dissertasiya müdafiəsində, elmi disputda çıxış etmək üçün qabaqcadan təyin olunmuş şəxs (alim).

**OPPONENTLİK** *is.* Opponent olma, opponent kimi çıxış etmə (dissertasiya müdafiəsində, elmi disputda). *Opponentlik etmək.*

**OPPORTUNİST** [*lat.*] 1. Opportunizm tərəfdarı, opportunizm siyasəti yeridən adam.

2. Opportunizmə aid olan, opportunizm məsləkli. *Opportunist qrup.*

**OPPORTUNİSTCƏSİNƏ** *zərf* Opportunist kimi, opportunistə yaraşan bir tərzdə. *Opportunistcəsinə hərəkət etmək.*

**OPPORTUNÍZM** [*fr.* opportunis – faydalı] Fəhlə hərəkatında və proletar partiyalarında marksizm-leninizmə zidd cərəyan; opportunizm proletariatın sinfi mənafeyini burjuaziyanın mənafeyinə tabe edir, burjuaziya ilə sazişçiliyi, əməkdaşlığı və inqilabi mübarizədən əl çəkməyi təbliğ edir.

**OPTÍK¹** *sif.* [*yun.*] 1. Optikaya aid olan. *Optik cihazlar.*

2. Optika hadisələrinə aid olan; işığın inikası və sınması qanunları üzündən törəyən, əmələ gələn. *Optik hadisə. Optik müşahidə.*

**ÓPTİK²** [*yun.*] 1. Optika mütəxəssisi.

2. Optik şüşə və cihazlar hazırlayan usta.

**ÓPTİKA** [*yun.* optike] 1. Fizikanın işıq, onun xassə və qanunlarından bəhs edən şöbəsi. *Optika qanunları.*

2. *top.* İşləməsi işığın inikası, sınması qanunlarına əsaslanan cihaz və alətlər.

**OPTİMÁL** *sif.* [*lat.* optimus – yaxşı] *kit.* Ən əlverişli, ən münasib, ən müvafiq. *Ən optimal əkin dövrü. Optimal şərait.*

**OPTİMÍST** [*lat.*] Optimizmə mail adam; nikbin.

**OPTİMİSTCƏSİNƏ** *zərf* Nikbincəsinə.

**OPTİMİSTLİK** *is.* Optimist (nikbin) adamın hal və sifəti; nikbinlik.

**OPTİMÍZM** [*lat.* optimus – yaxşı] Həyatda hər şeyi yaxşı görmə, gələcəyə inam meyli və buna görə də özünü həmişə gümrah, şən hiss etmə; nikbinlik. *Firəngizdəki sakitlik, optimizm ananı toxtadırdı.* B.Bayramov.

**ORA** *zərf* (bəzən əvəzlik mənasında işlənir). O yer. *Ora nə yaxşı yerdir? Ora haçan gedəcəksən? – Keçdi çox illər, olmadı orda; Bir müsafir gəlib sirab olsun.* A.Səhhət. [Sultan bəy:] *Srağagün həkim Mirzə Hüseynə deyirəm ki, oram ağrıyır.* Ü.Hacıbəyov.

**ORA-BURA** *zərf* 1. Həm ora, həm bura; o tərəf-bu tərəfə, hər tərəfə. *Ora-bura qaçmaq.* – [Nəsir] *yenə əvvəlki kimi ora-bura yortan .. idi.* S.Hüseyn.

2. Bütünlüklə deyil, hissə-hissə; müxtəlif yerdən, o yerindən-bu yerindən. [Rüstəm Mayaya:] *Al, bir ora-burasından oxu, görüm nə yazır.* M.İbrahimov.

**ORADA** *zərf* (bəzən əvəzlik mənasında işlənir). O yerdə. *Orada heç kəsi görmədim.* – [Cavad:] *Orada hava başqa rəngdədir.* H.Nəzərli. [Məşədi İbad Sərvərə:] *Bəs orada nə qayırırsan?* Ü.Hacıbəyov.

**ORADA-BURADA** *zərf* Müxtəlif yerlərdə; həm orada, həm də burada; adda-budda yerdə. *Camaat vəkilləri yığılıb koma-koma orada-burada söhbət edirdilər.* Ə.Haqverdiyev.

**ORADACA** *zərf.* 1. Həmin o yerdə, lap orada. *Oradaca dayandım.* – [Usta:] *Qan məni götürdü, yıxılıb oradaca qaldım.* Çəmənzəminli.

2. O zaman, o vaxt, o an. *Oradaca dedi.* – *Lakin* [Rüstəm] *elə oradaca vədini unudaraq heç bir şey etməmişdi.* M.İbrahimov.

**ORADAKI** *sif.* 1. O yerdə olan, o yerdə duran, o yerdəki. *Oradakı kitabları oxu. Oradakı binalar qəşəngdir.*

2. Bəzən əvəzlik mənasında işlənir. *Oradakıların xəbəri yoxdur.*

**ORADAN** *zərf* (bəzən əvəzlik mənasında işlənir). O yerdən. *Oradan gəlirəm.* – [Hacı:] *Qəlbim alışıb bu macəradan; Tez qapdım o tifli mən oradan.* C.Cabbarlı. *..Şofer .. təsadüfən oradan keçən başqa bir maşınla geri qayıtmışdı.* S.Hüseyn.

**ORADAN-BURADAN** *zərf.* 1. Bir yerdən deyil, müxtəlif yerlərdən. *Oradan-buradan yüz manat tapdım.*

2. Müxtəlif mənbələrdən, ayrı-ayrı məxəzlərdən. *Oradan-buradan xəbər bilmək.*

**ORÁKUL** *is.* [*yun.*] Antik dövrdə qeybdən xəbər verən kahin; falçı, rəmmal.

**ORAQ** *is.* Taxıl, ot və s. biçmək üçün qısadəstəli, yarımdairəvi kəsici kənd təsərrüfatı aləti. *Oraqla ot biçmək.* – *Bir cüt oraqdan başqa bizdə bir zad yoxdur.* M.F.Axundzadə. [Tanrıverdi] *qıraq-bucaqda orağı hərlədi, xeyli ot çıxarıb düzə tökdü.* S.Rəhimov.

**ORAQÇI** *is. məh.* Biçinçi.

**ORAQÇILIQ** *is. məh.* Biçinçilik.

**ORAQLAMA** "Oraqlamaq"dan *f.is.*

**ORAQLAMAQ** *f.* Oraqla biçmək. *Otu oraqlamaq.*

**ORAQLANMA** "Oraqlanmaq"dan *f.is.*

**ORAQLANMAQ** *məch.* Oraqla biçilmək. *Zəmi oraqlandı.*

**ORAQLATMA** "Oraqlatmaq"dan *f.is.*

**ORAQLATMAQ** *icb.* Oraqla biçdirmək. *Sahəni oraqlatmaq.*

**ORAQLI** *sif.* Əlində oraq olan, oraqla işləyən. *Oraqlı biçinçi.*

**ORAQVARİ** *sif.* Oraq şəklində, orağa oxşayan, oraq kimi; yarımdairəvi. *Qarayonca cinsinin paxlaları oraqvaridir.* H.Qədirov.

**ORALI** *sif.* O yer əhalisindən olan, o yerli. *Mən oralı deyiləm.*

**ORANJERÉYA** [*fr.*] İlin soyuq fəsillərində tərəvəz, gül, meyvə və s. yetişdirmək üçün şüşəbəndli yer; istixana. *Oranjereyada pomidor əkmək.* – [Mil düzündə] *tamamilə müasir üsulda tikilmiş və bütün ittifaqımızda görkəmli yer tutan bir oranjereya vardır..* M.İbrahimov.

**ORANQUTÁNQ** [*malay.* orangutang – meşə adamı] İnsanaoxşar iri meymun. [Həsən bəy:] *..Mən özüm də meymuna bənzəyirəm. Amma bir o qədər yox. Məşədi İbad isə lap oranqutanq meymundur ki, durubdur.* Ü.Hacıbəyov.

**ORATÓRİYA** [*ital.*] Xor, solist müğənnilər və orkestr tərəfindən konsertlərdə ifa olunmaq üçün yazılmış dramatik mövzulu iri musiqi əsəri. *Oratoriya – simfonik orkestr xor və solistlər üçün bəstələnən çoxhissəli, monumental və sanballı musiqi əsəridir.* Ə.Bədəlbəyli.

**ORBÍT** [*lat.*] 1. *astr.* Göy cisminin hərəkət etdiyi yol. *Marsın orbiti.* // Süni peyklərin, kosmik gəmilərin hərəkət etdiyi yol. *Kosmik gəmi Yer səthi üzərində perigeyi 175 kilometr və apogeyi 302 kilometr olan orbitə çıxmışdır.*

2. *məc.* Mehvər. *Tamahlar var, məqam tapıb orbitə çıxsa; Qitələrin gözlərinə qor atacaqdır.* M.Araz.

**ORD** *is.* Ağız boşluğunun yanaqlar tərəfində olan hissələrindən biri. [Xanməmməd] *ordlarının ikisi də şişik bir halda şəhərin yeni xəbərlərini nağıl eləməyə başladı..* Çəmənzəminli. *Zurnaçı orduna doldurduğu havanı bilmədi hara üfürsün.* Mir Cəlal.

◊ **Ordu (ordları) batmaq** – aclıq, xəstəlik və s. nəticəsində çox arıqlamaq, zəifləşmək. *Batıb uşaqların aclıqdan ordu; Bir tərəf üsyandır, bir tərəf ordu.* S.Vurğun. *Xavər dörd aylıq dəhşətli əzablardan arıqlamış, ordları batmış Kərimxana baxır, gözünü sarıqlı gözündən çəkə bilmirdi.* M.İbrahimov. **Ordu**

**orduna keçmək** – b a x **ordu (ordları) batmaq**. *Xəstənin ordu orduna keçmişdi.*

**ORDEN**[1] [*alm.* orden, *lat.* ordo – sıra, dərəcə] Hərbi və ya mülki xidmətlərə görə dövlət tərəfindən verilən müxtəlif dərəcəli və adlı fərqlənmə nişanı. "*İstiqlal*" *ordeni. Ordenlə təltif etmək. – Mükafat alanlar bir-bir çağırılır, orden, yaxud medal verilir, təbrik edilir, müvəffəqiyyətlər arzulanırdı..* Ə.Vəliyev. *Əsgər tək döşünü verib irəli; Ordenlər, medallar sinəsindədir.* H.Arif.

**ORDEN**[2] [*lat.*] Katolik kilsəsinin müəyyən məramnaməsi olan rahib və ya rıtsar-rahib icması; təriqət. *Dominikan ordeni.* // Bəzi gizli birliklərin, cəmiyyətlərin adı. *Mason ordeni.*

**ORDENLİ** *sif.* Ordeni olan, ordenlə təltif edilmiş (b a x **orden**[1]). *Ordenli qəhrəman.* – [Qəhrəman:] *Həmin bu gördüyünüz ordenli Narıngül mənim anamdır.* Ə.Vəliyev.

**ÓRDER** [*fr.* ordre – əmr] Yazılı sərəncam, əmr; bir şeyi vermək və ya almaq üçün sənəd. *Kassanın məxaric orderi.* – *..Yeni mənzil orderini də* [müdir] *özü vermişdi.* Mir Cəlal.

**ORDERLİ** *sif.* Order verilmiş, orderi olan. [Qədirin] *yaşadığı otaqlara da əli orderli işçilər daşındığı üçün özü ailəsi ilə bərabər oranı tərk etməyə məcbur olmuşdur.* S.Hüseyn.

**ORDİNAR** [*lat.*] *köhn.* 1917-ci il rus inqilabından əvvəl elmi vəzifə adlarının tərkibində "ştatda olan", "ştatlı" mənasında işlənən söz. *Ordinar professor.*

**ORDİNÁT** [*lat.* ordinatus – qaydada düzülmüş] *riyaz.* Nöqtənin fəzadakı vəziyyətini müəyyənləşdirən üç koordinatdan biri.

**ORDİNÁTOR** [*lat.*] Xəstəxana, klinika və s.-də şöbə müdirinin rəhbərliyi altında işləyən, müalicə aparan həkim.

**ORDİNÁTORLUQ** *is.* Ordinatorun işi, vəzifəsi.

**ORDİNÁTURA** [*lat.*] 1. Təcrübi tibb aspiranturasının bir növü.

2. Ordinator vəzifəsi.

**ORDU** *is.* 1. Dövlətin silahlı qüvvələri (quru qoşunları, hərbi dəniz və hərbi hava qüvvələri). [Uğur:] *Dördüncü kursdan orduya alındıq.* İ.Əfəndiyev. [Mahmud:] *Mən vaxtı ilə orduda qulluq etmişəm.* S.Vəliyev.

2. Hərbi dəniz və hərbi hava qüvvələrindən fərqli olaraq quru qoşunları. *Ordu ilə hərbi dəniz və hərbi hava qüvvələrinin birgə təlimi.*

3. Bir neçə korpusdan, diviziyadan ibarət operativ qoşun birləşməsi. *Birinci ordu. Beşinci ordu komandiri.*

4. *məc.* Ümumiyyətlə, çoxlu, saysız-hesabsız adamlar toplusu haqqında. *İşsizlər ordusu.*

**ORDUBAŞI** *is. köhn.* Orduya komandanlıq edən şəxs; sərkərdə.

**ORDUGAH** *is.* Qoşunların, məskun məntəqələrdən kənarda müvəqqəti mənzil saldıqları yer. *Qoşunlar ordugaha qayıtdılar. – Səhnə Tərtər çayı sahilində İsgəndərin ordugahını və çadırlarını təsvir edir.* A.Şaiq. [Zabit:] *Göz-qulaq ol! – əmrini verdikdən sonra ordugaha döndü.* H.Nəzərli.

**ORFOEPİK** *sif.* [*yun.*] Orfoepiyaya aid olan, orfoepiya ilə əlaqədar olan.

**ORFOÉPİYA** [*yun.* orthos – düzgün və epos – nitq] Düzgün ədəbi tələffüzü müəyyənləşdirən qaydalar sistemi. *Azərbaycan dilinin orfoepiyası.* // Tələffüz qaydalarını gözləmə.

**ORFOQRAFİK** *sif.* [*yun.*] Orfoqrafiyaya aid olan, orfoqrafiya ilə əlaqədar olan. *Orfoqrafik səhv.*

**ORFOQRAFİYA** [*yun.* orthos – düzgün və grapho – yazıram] Hər hansı bir dildəki bütün sözlərin hamı tərəfindən qəbul edilmiş düzgün yazılış qaydaları sistemi; imla. *Azərbaycan dilinin orfoqrafiyası.* // İmla qaydalarının gözlənilməsi. *Əlyazmasının orfoqrafiyasını yoxlamaq.*

**ORGİYA** *is.* [*yun.*] 1. Qədim Şərq, yunan, Roma allahlarına sitayişlə bağlı keçirilən bayram mərasimləri.

2. Azğın kef məclisi.

**ORİJİNÁL** [*yun.*] 1. *is.* Bir yazının, şəklin və s.-nin əsli (*surət* qarşılığı). *Portretin orijinalı. Kitabın orijinalı.* // Başqa dilə tərcümə üçün əsas olan mətn, başqa dilə tərcümə olunan mətnin əsli. *Tərcümənin orijinala yaxınlığı.* // Mətbəədə yığılan, yaxud kompyuterdə yazılan mətnin əlyazısı. *Orijinalla tutuşdurub yoxlamaq.*

2. *sif.* Bir şeyin – yazının, şəklin və s.-nin əsli olan, surəti olmayan. *Sikkələrin orijinal nüsxəsi.*

3. *sif.* Müstəqil yaradıcılıq məhsulu olan, başqalarından götürülməyən, başqasına təqlidən yaradılmayan, tərcümə olmayan. *Orijinal əsər.*

4. *sif.* Başqalarına oxşamayan, təqlidçilikdən uzaq olan, ancaq özünə məxsus olan. *Orijinal talant.* // Qeyri-adi, qəribə. *Orijinal adam.*

**ORİJİNALLIQ** *is.* 1. Başqalarına oxşamama, ancaq özünə məxsus olan hal, keyfiyyət və sifətlər. [Mirzağa Əliyevin] *yaratdığı Kərəmov surəti öz təbiiliyi, satirik qüdrəti, orijinallığı ilə heç bir zaman unudulmayacaqdır.* İ.Əfəndiyev.

2. Orijinal adamın hal və hərəkəti; qəribəlik.

**ORİYENTALİST** [*lat.*] Oriyentalistika (şərqşünaslıq) mütəxəssisi; şərqşünas.

**ORİYENTALÍSTİKA** [*lat.*] Şərq ölkələrinin tarixini, iqtisadiyyatını, dillərini, incəsənətini və s. öyrənən elmlərin hamısı bir yerdə; şərqşünaslıq.

**ORİYENTALİZM** [*lat.*] 1. Şərqə, Şərq mədəniyyətinə göstərilən maraq; Şərqi öyrənmə.

2. Bir şeydə nəzərə çarpan Şərq ruhu, Şərq xüsusiyyəti; şərqçilik.

**ORİYENTİR** [*lat.*] Hərəkətin istiqamətini müəyyənləşdirmək, hədəfi tapmaq üçün açıq yerdə yaxşı görünən hərəkətsiz şey.

**ORKÉSTR** [*fr.* orchestre, əsli *yun.* orchestra – qədim yunan teatrında səhnə qabağında yer] 1. Musiqi əsərini müxtəlif alətlərdə bir yerdə ifa edən çalğıçılar dəstəsi, habelə bu müxtəlif musiqi alətlərinin hamısı bir yerdə. *Simfonik orkestr. Xalq çalğı alətləri orkestri. Simli orkestr. – Qalxdıqca orkestrin ahəngi pərdə-pərdə; Torpaqdan qüvvət alıb göylərə uçuruq biz.* S.Rüstəm.

2. Teatrda, səhnə qabağında musiqiçilərin oturduqları yer.

**ORKESTRLƏMƏ** "Orkestrləmək"dən *f.is.*

**ORKESTRLƏMƏK** *f.* 1. *mus.* Orkestr musiqi əsərini partitura şəklində işləmək, yazmaq. *Operanı orkestrləmək.*

2. Hər hansı musiqi əsərini orkestrdə ifa olunmaq üçün uyğunlaşdırmaq. *Fortepiano pyesini orkestrləmək.*

**ORKESTRLƏNMƏ** "Orkestrlənmək"dən *f.is.*

**ORKESTRLƏNMƏK** *məch. mus.* Orkestrdə ifa olunmaq üçün işlənilmək, uyğunlaşdırılmaq (musiqi haqqında).

**ORKESTROVKA** [*rus.*] Orkestr üçün işlə(n)mə, uyğunlaşdır(ıl)ma; orkestrləmə.

**ÓRQAN** [*yun.* organon – alət] 1. İctimai həyatın hər hansı bir sahəsində müəyyən vəzifəni ifa edən idarə, təşkilat və s. *Səhiyyə orqanları. Ali hakimiyyət orqanı. İnzibati orqanlar.*

2. Hər hansı bir partiyaya, ittifaqa, idarəyə mənsub olub onun fikrini və fəaliyyətini ifadə edən qəzet, jurnal və s. "*Azərbaycan*" *jurnalı Azərbaycan Yazıçılar Birliyinin orqanıdır.*

**ORQÁN** [*yun.* organon – alət] İçərisinə körüklərlə hava doldurulan borular sistemindən ibarət olan iri klavişli musiqi aləti; ərğənun.

**ORQANÇALAN, ORQANÇI** *is.* Orqanda çalan musiqiçi.

**ORQANÍZM** [*lat.*] 1. Hər cür canlı vücud (insan, heyvan, bitki). *Ən sadə orqanizmlər. Bitki orqanizmi.* // Canlı insan və ya heyvan bədəni. *İçki, papiros orqanizmə zərərdir. Orqanizmi bərkitmək. Orqanizmin davamlılığı.*

2. *məc.* Bir-birilə uyğun surətdə işləyən hissələri olan şey. *İctimai orqanizm. Teatr mürəkkəb bir orqanizmdir.*

**ORMAN** *is.* Meşə. *Ətraf bir orman kimi ağaclıq idi.* S.Hüseyn. *Bülbüllər ormanda edirlər fəğan; Aydınlıq gecədir gündüztək hər yan.* H.K.Sanılı.

**ORMANLI** *sif.* Meşəli, çox ağaclı. *Bəli, bizim kənd, daha doğrusu, bizim oba Səngər adlanan, meşəli, ormanlı uca dağın ətəyində yerləşir..* S.Rəhimov.

**ORMANLIQ** *is.* Meşəlik. *Burası qalın, sıx ormanlıq, sərt qayalıq, uçurumlu dərdlərlə qucaqlanmışdı.* A.Şaiq.

**ORNÁMENT** [*lat.* ornamentum – bəzək] Rəssamlıqda, heykəltəraşlıqda və s.-də: təkrarlanan həndəsi elementlərdən və ya bitki və heyvan motivlərindən ibarət naxış, bəzək. *Xan sarayının ornamentləri. Qədim Şərq ornamentləri.*

**ORNAMENTÁL** *sif.* [*lat.*] Ornamentlərdən ibarət olan; ornament mahiyyətində olan, ornament mahiyyəti daşıyan. *Ornamental me-*

*marlıq əsəri*. – [“Azərbaycan xalçaları” kitabına] *20-ci illərdən bu günədək hazırlanan ornamental, portretli və yubiley xalçaları daxil edilmişdir.*

**ORNAMENTÇİ** *is.* Ornament ustası olan sənətkar.

**ORNAMENTÇİLİK** *is.* Ornamentçinin işi, sənəti.

**ORNAMENTLİ** *sif.* Ornamenti olan, ornamentlərlə bəzədilmiş; ornamental. *Ornamentli divar yazısı.*

**ORNİTOLÓGİYA** [*yun.* ornitos – quş və logos – nəzəriyyə] Zoologiyanın quşlar bəhsi.

**ORNİTOLOJİ** *sif.* [*yun.*] Ornitologiyaya aid olan, ornitologiya ilə əlaqədar olan.

**ORNİTÓLOQ** [*yun.*] Ornitologiya mütəxəssisi.

**OROGEN** *is.* [*yun.*] Geosinklinalların inkişafının ikinci mərhələsi.

**OROQRAFİK** *sif.* [*yun.*] Oroqrafiyaya aid olan, oroqrafiya ilə əlaqədar olan.

**OROQRÁFİYA** [*yun.* oros – dağ və grapho – yazıram] Fiziki coğrafiyanın, Yer səthinin relyefini öyrənən şöbəsi.

**ORONİM** [*yun.*] Dağ adları.

**ORTA** 1. *is.* Bir şeyin kənarlarından, uclarından az-çox bərabər dərəcədə aralı olan yer; bir şeyin mərkəzi. *Kəndin ortası. – Otağın ortasında bir soba vardı.* S.Hüseyn. *Dördkünc həyətin ortasında dördkünc bir bağça, bağçanın ortasında yenə dördkünc bir hovuz vardı.* Ə.Əbülhəsən. // Çay, yol və s.-nin hər iki tərəfindən az-çox bərabər məsafədə olan yer. *Çayın ortasına gedəndə su* [Eyvaz kişini] *süpürlədi.* Ə.Vəliyev. *Vəkil yolun ortasında qanqal kolu kimi tənha görünürdü.* Mir Cəlal.

2. *sif.* Ortada olan, bir şeyin kənarlarından, uclarından eyni məsafədə aralı olan; iki nöqtə (xətt, şey və s.) arasında olan. *Evin orta pəncərəsi. Orta otaq. – Danalar yenə əvvəlki kimi orta payanı söküb yeyirdilər.* M.Hüseyn.

3. *is.* Bir şeyin başlanğıcından, ya sonundan eyni dərəcədə uzaq olan vaxt, zaman. *Yayın ortası. Ayın ortası. Günün ortasında. – İyul ayının ortası idi.* N.Nərimanov.

4. *sif.* Böyüklə kiçik, yüksəklə alçaq, ağırla yüngül və s. arasında olan. *Orta və ağır tank. Orta və xırda burjuaziya.* // *sif.* Təcrübəsi az olan; miyanə, babat. *Orta dərzi*. – [Rüstəm:] *Mən bir şeyi başa düşmürəm, ortaların* (is.) *ayağı ilə yerimək irəli getməkdir?* M.İbrahimov.

5. *sif.* Bir neçə kəmiyyətin onların sayına bölünməsindən alınan; adi, nəzərdə tutulan hadisə və s. üçün tipik olan. *Orta illik temperatur. Orta əmək haqqı. Orta sürət.* // *sif.* Keyfiyyətcə nə yaxşı, nə də pis olan; babat, miyanə. *Orta keyfiyyətli mal.*

6. *is.* Tələbələrin biliyinə verilən “pis” qiymətlə “yaxşı” qiymət arasındakı qiymət, kafi – “3”. *Tarixdən* “*orta*” *almaq.* “*Orta*” (sif.) *qiymət.*

7. *sif.* Üçdən ikincisi. *Orta qardaş* (*bacı*).

8. *is.* İki şey arasında olan boş yer; boşluq, ara, aralıq. *Ülkər də seyr edib öz anasını; Ortada quş kimi qol-qanad açır.* S.Vurğun. *Çobanlar və yeniyetmələr alaçığın yanlarına çəkilərək yeməyi yığışdırıb ortanı açdılar, oynamağa başladılar.* M.İbrahimov.

◊ **Orta barmaq** – şəhadət barmağı ilə adsız barmaq arasındakı barmaq. **Orta əsrlər** – V-XV əsrləri əhatə edən dövr. *Orta əsr ədəbiyyatı. Orta əsrlərə aid memarlıq abidələri.* **Orta hesabla** – təxminən, təxmini. *Sortluq toxum məntəqələrində hər hektardan orta hesabla 170 sentner kartof məhsulu götürürlər.* **Orta məktəb** – ali məktəbə daxil olmaq, yaxud ümumi və ya orta ixtisaslı mütəxəssis kimi işləmək üçün kifayət edən ümumi təhsil verən məktəb. *Orta musiqi məktəbi. – Gülşad orta məktəbin son sinfində oxuyan vaxt müharibənin ağır ili idi.* Ə.Vəliyev. **Orta təhsil** – orta məktəbdə alınan təhsil. *Orta təhsil haqqında kamal attestatı.* – [Şükür] *orta təhsilini bitirmiş, ali məktəbə girmək istəməmişdi.* S.Hüseyn. **Orta yaş (sini)** – nə cavan, nə qoca; cavanlıqla qocalıq arasındakı yaş. *Mirzağa qısaboylu, şişmanqarınlı, cücəgözlü, yekəburunlu və qalındodaqlı, orta sinlərdə bir adam idi.* H.Nəzərli. **Ortada qalmaq** – b a x **arada qalmaq** 1-ci mənada (“**ara**”da). **Ortada yeyib qıraqda (kənarda) gəzmək** – 1) bir işi görmədiyi halda başqalarının əməyinin səmərəsindən faydalanmaq; 2) boş-boş gəzmək, veyllənmək, avaralanmaq. *Banıçiçəkdə gözü olanlardan biri də .. ortada yeyib qıraqda gəzən ağ bir bəy oğlu idi.* M.Rzaquluzadə. **Ortadan çıxarmaq** – b a x **aradan**

**çıxarmaq** (“**ara**”da). *Bayram aşağı əyildi, yerə sərilmiş fəhlələrdən birini qucağına alıb ortadan çıxartdı.* M.Hüseyn. **Ortadan çıxmaq** – b a x **aradan çıxmaq** (“**ara**”da). **Ortadan qaldırmaq (götürmək)** – b a x **aradan qaldırmaq (götürmək)** (“**ara**”da). **Ortaya almaq** – b a x **araya almaq** (“**ara**”da). **Ortaya atmaq** – b a x **araya atmaq** (“**ara**”-da). *Güləsərin əlacı olsa, onu* [atasını] *heç yana buraxmazdı. Özü qolunu çırmayıb ortaya atılardı.* İ.Şıxlı. **Ortaya çıxmaq** – b a x **meydana çıxmaq** (“**meydan**”da). *Bir çox çətinliklər ortaya çıxdı.* – [Döyüş meydanında] *qorxmaz, fərasətli adamlar tez ortaya çıxır.* S.Vəliyev. **Ortaya düşmək** – 1) bir iş görməyə təşəbbüs etmək; 2) b a x **araya düşmək** (“**ara**”da). **Ortaya gəlmək** – b a x **araya gəlmək** (“**ara**”da). *Siniyə çəkilən xingal buğlana-buğlana ortaya gələndə Tahir .. oturdu.* M.Hüseyn. **Ortaya qoymaq** – b a x **araya qoymaq** (“**ara**”da). *Uşaqlar çarpayılarından düşdülər. Əllərinə keçən kitabları vərəqlədilər. Kim nədən şübhələndisə gətirib ortaya qoydu.* İ.Şıxlı. **Ortaya söz salmaq** – b a x **araya söz salmaq** (“**ara**”da).

**ORTABAB** *sif.* 1. Ortayaş(lı), orta yaşlarda olan; nə cavan, nə qoca. *..Şərəf ortabab, qara və arıq övrətdi.* C.Məmmədquluzadə.

2. Orta keyfiyyətli; miyanə. *Əlikram gətirdiyi iki dənə ortabab Quba almasını qəzetdən açıb təbərrük kimi çıxartdı.* B.Bayramov.

3. Kiçik torpaq sahəsinə malik olub, onu öz əməyi ilə becərən və mülki vəziyyətinə görə yoxsulla qolçomaq arasında duran fərdi təsərrüfatçı kəndli. [Almas:] *Yoldaşlar, mənim sözüm yoxsul və ortabab kəndlilərədir.* C.Cabbarlı. *Cavahir, doğrusu, mən muzdur oğlu; Sən də bir ortabab kəndli qızısan.* M.Müşfiq. // İs. mənasında. *Kənd yoxsulları ilə ortababların ittifaqı.*

**ORTABABLIQ** *is.* Orta yaşda, orta vəziyyətdə olma. [İmanov] *ortaboylu, bozumtul qısa saçlarını geri daramış, buğdayısifət, gözləri tünd-qara, gülümsər bir kişi idi.* M.Hüseyn. *Ortaboy ağ kəlağayılı bir qadın irəli yeridi.* Mir Cəlal.

**ORTABOYLU** *is.* Boyu orta olma.

**ORTAQ** *is.* Birlikdə görülən işin, əsasən alverin iştirakçılarından hər biri; şərik. *Ortaq çox olduqda ziyan az olur.* (Ata. sözü). [Musanın nəvəsi] *qəzada qalıb atasının ortağı ilə ticarətə qurşandı.* Qantəmir. ☐ **Ortaq olmaq** – başqası ilə birlikdə bir iş görmək, bir işə iqdam eləmək, şərik olmaq. *Murovlar olublar oğruya ortaq.* Q.Zakir. *Yaz gələndə Qurban ala öküzü qoyub ortaq olur, çala yerini əkirdi.* S.Rəhimov. // *Zərf mənasında.* Birlikdə, şərikli. [Əhməd] *bir tacirlə də ortaq alver etmək istəyəndə etibarı olmadığından heç kəs ona yaxın durmayırdı.* B.Talıblı.

◊ **Ortaq bölən** *riyaz.* – bir neçə ədədin qalıqsız bölündüyü ədəd; məs.: 3 ədədi 6, 12, 21 ədədlərinin ortaq bölənidir. **Ortaq bölünən** *riyaz.* – bir ədədə qalıqsız bölünən ədədlər; məs.: 4, 6, 20 ədədləri 2 ədədinin ortaq bölünənləridir.

**ORTAQLAŞMA** “Ortaqlaşmaq”dan *f.is.*

**ORTAQLAŞMAQ** *f.* Ortaq olmaq, şərik olmaq.

**ORTAQLI** *sif.* 1. Bir neçə adamın iştirak etdiyi; şərikli. *Ortaqlı təsərrüfat.*

2. Bir neçə ortaq, şərik tərəfindən istehsal olunan. *Cəlil cavab verdi ki, yerini satmayacaqdır, ancaq bir hissəsini ortaqlı neft üçün verə bilər.* İ.Musabəyov.

**ORTAQLIQ** *is.* Ortaq olma; şəriklik.

**ORTALIQ** *is.* 1. B a x **aralıq** 1-ci mənada. *Ortalıqda qalan şeyləri götürmək.*

2. Açıq yer, meydan, sahə. *Ortalıqda qoca .. ağac, altında da Qoşabulaq durna gözü kimi qaynayır, göz yaşı kimi axıb ətrafı süd gölünə döndərir.* “Koroğlu”.

3. Adamların arasında qalan boş yer; aralıq. *Ortalıqda oynayan iki qız süzə-süzə Kiçikbəyimin qarşısına gəldi, .. onu oyuna dəvət etdilər.* Çəmənzəminli.

4. Otağın və s.-nin içi, daxili, ortası. *Otağın ortalığı.* – *Qamış evdə yanır bucaqda çıraq; Oynayır ortalıqda körpə uşaq.* A.Səhhət.

5. Ara, aralıq. *Əl dəyəndə tez-tez küsə, barışa; Ortalıqda söhbət ola, söz ola.* Aşıq Ələsgər.

**ORTAM** *is.* Mühit, şərait, vəziyyət.

**ORTANCIL** *sif.* Böyüklə kiçik arasında olan; orta (bacı, qardaş və b. haqqında). *Ortancıl oğul düşmənin hücumundan qorxub qaçdı.* F.Köçərli. [Kərbəlayı Mehdi:] *Ortancıl qızım mənə oxşayıb, sözü dik deyir!* Çəmənzəminli.

..*Ortancıl bacı Asya orta məktəbi bitirdikdən sonra ərə getmiş*(*di*). Ə.Məmmədxanlı. // İs. mənasında. *Böyük qız lap kiçiyi yatırıb ortancılla oynayırdı.* Ə.Vəliyev. *Ortancıla çatdı növbət; Mənimkidir zəfər, əlbət; Deyib taxdı yarağını.* M.Dilbazi.

**ORTASİN(Lİ)** b a x **ortayaş(lı)**. *Ortasin(li) kişi.*

**ORTAYAŞ(LI)** *sif.* Nə qoca, nə də cavan; ortabab, ortasin(li). *Ortayaş*(*lı*) *qadın. – Musa qarabənizli, ortayaşlı, ortaboylu, qorxunc simalı bir tipdir.* H.Cavid. *Çayxana müdiri qapıda durub ortayaşlı bir kişi ilə danışırdı.* Çəmənzəminli.

**ORTİ́T** *is.* [*yun.*] Radioaktiv mineral.

**ORTODÓKS** [*yun.*] *kit.* Ortodoksal görüşlü.

**ORTODOKSÁL** [*yun.*] *kit.* Hər hansı bir əqidəyə, məsləkə, nəzəriyyəyə münasibətində sabit və ardıcıl olan; ardıcıl.

**ORTODOKSALCASINA** *zərf kit.* Ortodoks kimi, ortodoksal.

**ORTODOKSALLIQ** *is. kit.* Öz məsləkində, əqidəsində, dünyagörüşündə sabitlik; ardıcıllıq.

**ORTOQONAL** *is. riyaz.* Düzbucaqlı.

**ORTÓPED** [*yun.*] Ortopediya mütəxəssisi olan həkim; ortopedist.

**ORTOPEDİ́K** *sif.* [*yun.*] Ortopediya ilə bağlı olan, ortopediya ilə əlaqədar olan. *Ortopedik tədqiqat*. // Bədənin hər hansı deformasiyasının müalicəsi üçün olan. *Ortopedik gimnastika. Ortopedik ayaqqabı.*

**ORTOPEDİST** [*yun.*] b a x **ortoped**.

**ORTOPÉDİYA** [*yun.* orthos – düz və paideia – tərbiyə] Tibb elminin, onurğa və hərəkət üzvlərinin (əllərin, ayaqların) sabit deformasiyalarının öyrənilməsi, müalicəsi və profilaktikası ilə məşğul olan bəhsi.

**ORUC** *is.* [*fars.* "ruzə"dən] *din.* Müsəlman dininin tələbinə görə ramazan (orucluq) ayında müsəlmanların gün çıxandan gün batana qədər heç bir şey yeyib-içməməsi. [Molla Kazım:] *Deyirlər, oruc nahaq, namaz nahaqdır*. Ə.Haqverdiyev. ☐ **Oruc açmaq** – ramazan (orucluq) ayında günbatandan sonra yeyib-içmək. **Oruc bayramı** – b a x **orucluq bayramı** ("**orucluq**"da). *Novruz bayramında və oruc bayramında* [qız evinə] *tel, paxlava və s. həlviyyat xonça .. labüd gedəcəkdir*. R.Əfəndiyev. **Oruc tutmaq** – müsəlman dininin tələbinə görə ramazan (orucluq) ayında günçıxandan günbatana qədər heç bir şey yeyib-içməmək, ac qalmaq. [Xaspolad:] *Vallah, indi heç orucluqda da oruc tutmuram.* C.Cabbarlı. **Orucunu yemək** – oruc tutmamaq. [Kazım:] *Deyirlər bir kənddə bir qocanı orucunu yediyinə görə döyüblər.* Çəmənzəminli.

**ORUCLUQ** *is. köhn.* Hicri-qəməri təqvimin ramazan ayında oruc tutulduğu üçün həmin aya verilən ad. [Molla Nəsrəddin:] *Qazı ağa, orucluğun başlanmağını nədən bilmək olar?* "M.N.lətif." *Orucluqda bir axşamdan, bir də obaşdandan yeyərdilər ki, bütün günü ac qalmağa imkan olsun.* H.Sarabski. ☐ **Orucluq bayramı** – müsəlmanlarda: orucluq (ramazan) ayının qurtarması münasibətilə edilən dini bayram; oruc bayramı, fitr bayramı.

**OSETİN(LƏR)** Şimali Osetiyanın və Cənubi Osetiyanın əsas əhalisini təşkil edən xalq.

**OSETİNCƏ** *sif.* və *zərf* Osetin dilində. *Rusca-osetincə lüğət. Osetincə danışa bilmək.*

**OSMANLI(LAR)** Türkiyədə yaşayan türklərin köhnə adı. *Osmanlı deyir ki, millət azad olsun..* M.Ə.Sabir.

**OSTAN** *is.* [*fars.*] İranda inzibati ərazi vahidi. *Ostanlara bölünmək*.

**OT** *is.* 1. Ağaclara, kollara mənsub olmayan yaşıl gövdəli incə bitki. *Alaq otu. Yem otu. Ot biçmək*. – [Mələk] *bulağın qırağından bir çəngə ot yolub sənəyin ağzına basdı..* A.Divanbəyoğlu. // Yerin həmin bitkilərdən ibarət yaşıl örtüyü. *Otun üstü ilə getmək.*

2. Həmin bitkinin, yaş və ya quru halda heyvan yemi kimi işlədilən biçilmişi, açılmışı. *İnəyə ot vermək. Quru ot. – Niyaz da gah* [atın] *qabağına saman tökür, gah da ot qoyurdu.* Ə.Vəliyev.

◊ **Ot kökü (kök) üstə bitər** – övlad öz valideynlərinə çəkər, öz valideynləri kimi olar. [Hümmət Şahmara:] *Bəs deyirlər ot kökü üstə bitər, Əsəd kimi adamdan belə törəmə?!* B.Bayramov. **Ot yolun gah altında (sağında) bitər, gah da üstündə (solunda)** – həyatın həmişə bir tərzdə, bir qaydada getmədiyinə, gah pis, gah da yaxşı, gah yüngül, gah da ağır keçdiyinə işarə. [Səttar:] *Buna dünya deyərlər ey! Ot yolun gah altında bitər, gah da*

*üstündə!* Ə.Əbülhəsən. **Ota düşmək** – ot yeməyə başlamaq (otyeyən körpə heyvanlar haqqında). *Quzu ota düşüb. Buzov hələ ota düşməyib.*

**OTABƏNZƏR** *sif.* Ota oxşayan, ot kimi.

**OTAQ** *is.* 1. Mənzilin, evin divar və ya arakəsmələrlə bir-birindən ayrılmış qisimlərindən hər biri. *Üç otaqdan ibarət mənzil. Bu evdə neçə otaq var? – Qız cəld üstünü çırpıb, qızara-qızara otağa qaçdı.* Çəmənzəminli. [Vəzir:] *Siz gediniz, o biri otaqda gözləyiniz.* Ü.Hacıbəyov.

2. İdarədə, müəssisədə, vağzalda və s.-də xüsusi məqsədlər üçün ayrılmış yer. *İstirahət otağı. Qəbul otağı. Vağzalda ana və uşaq otağı.*

**OTAQCIQ, OTAQCA** *is.* Kiçik otaq, balaca otaq. *Otaqcığın bir tərəfində, balaca taxt üstündə samandan döşəkcə, illərlə üzü yuyulmamış balış.* N.Nərimanov.

**OTAQLI** *sif.* Otağı olan, yaşamaq üçün yeri, mənzili olan. *Qızı otaqlıya vermə, papaqlıya ver.* (Ata. sözü).

**OTAQSIZ** *sif.* Otağı olmayan, yaşamaq üçün yeri, mənzili olmayan.

**OT-ALAF** *top.* 1. Alaq otları. [Xarabalığa] *gedən cığırı da ot-alaf basmışdı.* M.İbrahimov. *Daşlıq yolun kənarlarında ot-alaf elə ucalmışdı ki, deyərdin buralar xüsusi biçənək yeridir.* Mir Cəlal.

2. Quru ot, alaf, saman və s.-dən ibarət heyvan yemi. *Ot-alaf tədarük etmək. – Mahmud .. ot-alaf yığılmış çardağın altına girdi.* Ə.Əbülhəsən.

**OTARILMA** "Otarılmaq"dan *f.is.*

**OTARILMAQ** *məch.* Otlaqda heyvanlara ot yedirdilmək.

**OTARMA** "Otarmaq"dan *f.is.*

**OTARMAQ** *f.* Otlaqda heyvanlara ot yedirmək. *Sürünü otarmaq. Quzuları otarmaq. – Alı kişi neçə illər idi ki, Həsən xana ilxı otarırdı.* "Koroğlu". [Uşaq] *əlində uzun bir dəyənək beş-altı baş keçi və qoyunu otarmağa aparırdı.* H.Nəzərli.

**OTARTMA** "Otartmaq"dan *f.is.*

**OTARTMAQ** *icb.* Yerdə bitən otu, bitkini otlamasına imkan vermək və ya bu işi gördürmək. *..Qonşunun əkinini otardanlar manifestə düşür, düşmənin tayasına od vuranlar manifestə düşür.* C.Məmmədquluzadə.

**OTBİÇƏN** *is.* Otbiçən maşın, alət. *Otbiçəni təmir etmək.* // Sif. mənasında. *Ümid .. otbiçən maşının, kombaynın yan-yörəsinə dolandı.* B.Bayramov.

**OTÇALAN** *is.* Otçalan maşın, alət; otbiçən. *Otçalanı yoxlamaq.* // Sif. mənasında. *..Kreditlə iki yüngül traktor, otçalan maşın və sairə aldım.* M.İbrahimov.

**OTDOĞRAYAN** *is.* Biçilmiş otu doğrayıb xırdalandıran maşın, alət. // Sif. mənasında. *Otdoğrayan maşın.*

**OTEL** [*fr.*] Mehmanxana. *Otel sahibi və onun dalısınca bir əcnəbi nömrəyə girdilər.* S.M.Qənizadə. *Restorandan aşağı Nemətin nəzərinə çarpan böyük bir otel oldu.* Çəmənzəminli.

**OTLAQ** *is.* 1. Çoxlu ot bitən və mal-qara otarılan yer. *Naxırı otlağa buraxmaq. – İnək, camış, qoyun, quzu çıxar naxırda otlağa; Köçər arandan el, gedər yavaş-yavaşca yaylağa.* A.Səhhət. *Otlaqdan geri dönüb; Gəlir kəndə quzular.* M.Seyidzadə.

2. B a x **otluq**. *Kiçikbəyim fındıq və yemişan kollarını əyərək otlaq bir talaya çıxdı.* Çəmənzəminli. *Yol kənarları bağ-bağçalıq, otlaq idi.* Mir Cəlal.

**OTLAMA** "Otlamaq"dan *f.is. Quzuçuların həvəslə oynamaları, quzuların iştahla otlamaları Gülşada ləzzət verirdi.* Ə.Vəliyev.

**OTLAMAQ** *f.* Otlaqda ot yemək. *Quzuları otlamağa aparmaq.* – [Vəzir:] *Hər yerdə sürüylə otlayır ceyran.* A.Şaiq. *Sürülər çöldə otlayırdı.* M.İbrahimov.

**OTLATMA** "Otlatmaq"dan *f.is.*

**OTLATMAQ** b a x **otarmaq**. [Şeyx Mərdan:] *O qadından qaçan böyük Sənan; Donuz otlatmaq üzrə oldu çoban.* H.Cavid.

**OTLU** *sif.* Ot olan, ot bitmiş. *Otlu sahə. Otlu yer.*

**OTLUQ** *is.* Çoxlu ot bitmiş yer; çəmən. *Birdən otluqdan iki-üç qırqovul qalxdı.* Çəmənzəminli. *Ulaqları o tərəfdəki otluğa buraxıb gələn Yusif atasının yanında durdu.* Ə.Abasov.

**OTSUZ** *sif.* Ot bitməyən, ot olmayan; çılpaq. *Otsuz düzənlik.*

**OTTARLALI** *sif. k.t.* Torpağın məhsuldarlığını bərpa etmək üçün tarlada vaxtaşırı ot əkməkdən ibarət əkin üsulu. *Ottarlalı əkin növü.*

**OTTİSK** *is.* [*rus.*] Çap olunmuş materialların ayrıca nüsxəsi; basmaca.

**OTUXMA** "Otuxmaq"dan *f.is.*

**OTUXMAQ** *f. məh.* Ot yeməyə başlamaq (körpə otyeyən heyvanlar haqqında).

**OTURACAQ** *is.* 1. Oturulan yer, üstündə oturmaq üçün şey, üstündə oturula biləcək hər şey. *Maşının oturacağı. – Divara söykənmiş oturacaqlarda oturduq.* S.Rəhimov. *Ələbbas tütün qutusunu oturacağa qoyub traktorun altına keçdi.* H.Seyidbəyli. // Stul, kürsü və s.-nin oturulan yeri. *Oturacağı toxunma kürsünün üstündə əyləşmiş Murad oğluna baxıb gülümsündü.* Ə.Vəliyev.

2. Bir tikilinin özülünü təşkil edən, yerdə duran alt hissəsi; özül, əsas, altlıq. *Binanın oturacağı. Heykəlin oturacağı. Stulun oturacağı.*

3. *riyaz.* Həndəsi fiqurun yerə dirənən aşağı hissəsi. *Konusun oturacağı.*

**OTURACAQLI** *sif.* Oturacağı olan.

**OTURAQ** 1. *sif.* Köçəri həyat keçirməyən, daim bir yerdə yaşayan (*köçəri* ziddi). *Oturaq əhali. – Lakin Camal kəndə gəlmək və oturaq həyat keçirmək istəmirdi.* M.S.Ordubadi. *Çox vaxt oturaq zehniyyəti ilə köçəri zehniyyəti bir-biri ilə toqquşaraq ortalıqda anlaşılmazlıq vücuda gəlirdi.* Çəmənzəminli. // Eyni mənada quşlar haqqında. *Oturaq quşlar bütün ili bir yerdə qalırlar. – Sərçə, sağsağan, daha şimal ölkələrimizdə isə çillər, tetra quşları oturaq quşlardandır.* "Zoologiya". // İqlim, yem və b. şəraitlə əlaqədar olaraq yerini dəyişməyən (mal-qara, balıq və s. haqqında). *Oturaq maldarlıq. – İncənin hər tərəfi otlaqdır. Buranın mal-qarası köçəri deyil, oturaqdır.* S.Rəhman.

2. *sif.* Bir yerdə oturmaqla, yerindən tərpənməyi tələb etməyən işlə əlaqədar olan. *Oturaq və hərəkətsiz həyat tərzi nəticəsində bədənin forması dəyişir, təndürüstlük pozulur.*

3. *is.* Oturulan, mənzil salınan yer, oturacaq yer, istirahət yeri, düşərgə və s. [Gözətçi] *ay işığında daşa söykənib mürgülədiyindən, bizim oturağa yaxınlaşmamızdan xəbəri olmamışdı.* H.Nəzərli. *Yorulanda olur sizə oturaq; Göl kənarı, yaşıl çəmən, durnalar!* S.Rüstəm.

4. *is.* Bir şeyin alt tərəfi, yerə və ya başqa bir şeyə dirənən tərəfi. *Qazanın oturağı ağzından gen olar.*

**OTURAQLIQ** *is.* Oturaq həyat sürmə, oturaq həyat tərzi (*köçərilik* ziddi).

**OTURDULMA** "Oturdulmaq"dan *f.is.*

**OTURDULMAQ** *məch.* Oturmağa məcbur edilmək, əyləşdirilmək.

**OTURMA** "Oturmaq"dan *f.is.*

**OTURMAQ** *f.* 1. Yanını bir yerə, ya oturacağa qoyub oturaq vəziyyət almaq, əyləşmək. *Buyurun, oturun! –* [Hacı Əhməd Almasa:] *Heç, elə belə gəldik, baş çəkək. Oturmaq olar?* C.Cabbarlı. *Ruhnəvaz xanım ciddi baxışına heç də təğyir verməyərək Qurbanlının qarşısında oturdu.* Çəmənzəminli.

2. Hərəkət etməyib durmaq, qalmaq. *Burada nə qədər oturub gözləyəcəyik? – Yusif və Bahadır gözlərini silib xeyli vaxt səssiz oturdular.* N.Nərimanov. // Heç bir işlə məşğul olmamaq, vaxtını boş keçirmək, boş durmaq. *Bu qədər oturmaq olar? Oturdun bəsdir. Oturmaqdansa, bir şeylə məşğul ol.*

3. Çökmək, dibi torpağa dirənmək, aşağı enmək. *Gəmi saya oturdu.* // Dibə çökmək, aşağı enmək. *Sudakı duzlar şüşənin dibinə oturdu.*

4. Yerinə düşmək, yerinə girmək, uyğun gəlmək. *Pəncərə çərçivəyə yaxşı oturmur.*

5. Əyninə yaxşı gəlmək, düz gəlmək, uyğun olmaq. *Paltar bədəninə yaxşı oturur.*

6. *dan.* Minmək. *Qatara oturmaq. – Atabala tramvaya oturub vağzala gedəsi oldular.* Mir Cəlal.

7. *məc.* Həbsdə olmaq, həbsxanada saxlanılmaq, məhbus olmaq. *Oğurluq üstdə üç il oturdu.*

◊ **Oturduğu yerdə** – b a x **dayanıb duran yerdə** ("**dayanmaq**"da). *Oturduğum yerdə cəncələ düşdüm.*

**OTURTMA** "Oturtmaq"dan *f.is.*

**OTURTMAQ** *icb.* 1. Əyləşdirmək. *Yanında oturtmaq. – Mənzilimdən sandalya alıb* [gələnləri] *münasib bir yerdə oturtdum.* S.Hüseyn. *Mədinə həmişəki kimin Vaqifi Topxanaya baxan bəzəkli pəncərənin içində oturtdu.* Çəmənzəminli. *Səkinə gəlini mütəkkə qoyulmuş divanda oturtdu.* M.İbrahimov.

2. Çökdürmək.

3. Yerinə salmaq, yerinə girdirmək.

4. Mindirmək. *Uşaqları qatara oturtmaq.*

5. Həbsə aldırmaq, həbs etdirmək.

**OTURUB-DURMA** 1. "Oturub-durmaq"-dan *f.is.*

2. Əlaqə, yoldaşlıq etmə, vaxtını bir yerdə keçirmə.

**OTURUB-DURMAQ** *f.* 1. Əlaqə saxlamaq, dostluq etmək, yoldaşlıq etmək. [Pəricahan xanım:] *Mehdi ağanın nəvəsi Ağca xanıma bir qaraçı qızı ilə yoldaş olub, oturub-durmaq yaraşmaz.* S.S.Axundov. [Balaş Sevilə:] *..Mən indi böyük cəmiyyət adamıyam, doktorlar, ədiblər, filosoflarla oturub-dururam.* C.Cabbarlı.

2. **Oturub-durub** şəklində – həmişə, daima, hər zaman. *Gülü arvad oturub-durub uşaqlarına belə nəsihət verərdi*. S.Rəhimov. *Sevdim kişi haqqında Paşa bəy oturub-durub deyirdi..* Ə.Vəliyev.

**OTURUM** *is.* Oturmaq işi, oturma.

**OTURUŞ** *is.* Oturma tərzi, oturma qaydası. *Oturuşuna fikir vermək. – Oturuşu Şirin, duruşu Leyli; Həm özü, həm fikrü xəyali sərxoş!* M.P.Vaqif. *Gəldiyevin bu sakit oturuşu xiffət çəkən adamın oturuşuna oxşamır.* Mir Cəlal.

**OTURUŞMA** "Oturuşmaq"dan *f.is.*

**OTURUŞMAQ** *f.* 1. Hamı özünə yer tapıb oturmaq. *Qonaqlar oturuşdular*.

2. *məc.* Yaşa dolmaq, ahıllaşmaq, köhnəlmək, qartmaq.

**OTURUŞMUŞ** *sif.* və *is. dan.* Yaşlı, ahıl, qartımış. *Müəllim yaşca oturuşmuş adamdı.* Ə.Vəliyev.

**OTUZ** *say*. İyirmi doqquzdan sonra gələn say – 30. *Otuz manat. Otuz nəfər. – Altmış nisbi, otuz cüzi müttəsil; Doxsan min kəlmədə tamamı vardır.* Aşıq Ələsgər.

**OTUZCA** *say*. Ancaq otuz, yalnız otuz. *Otuzca manat pulum var.* - [Mirzədadaş:] *Hətta mən ondan otuzca manat cib xərcliyi alaram.* N.Vəzirov.

**OTUZGÜNLÜK** *sif.* Otuz gün sürən və ya sürmüş; biraylıq. *Otuzgünlük ezamiyyət*. // Otuz gün vaxt tələb edən; biraylıq. *Otuzgünlük işimiz qalıb.*

**OTUZİLLİK** *sif.* 1. Otuz il davam etmiş və ya edən. *Otuzillik bir dövr. Otuzillik mübarizə.*

2. Otuz illiyə həsr olunmuş, otuz ilin tamam olması ilə əlaqədar olan. *Otuzillik yubiley.*

**OTUZLUQ** 1. *is. köhn*. Üç onluqdan ibarət, otuz manat dəyərində olan kağız pul. *Otuzluğu xırdalamaq*. – [Poçtalyon:] *Elə ki, şad xəbər gətirirəm, çıxarıb bir otuzluq ilə yola salırsınız.* Mir Cəlal.

2. *sif.* Bir şeyin dərəcəsini, nömrəsini, otuz vahiddən ibarət olduğunu göstərir. *Pəncərə önündə axşamdan otuzluq lampa yanırdı.* M.Hüseyn.

**OTUZMƏRTƏBƏ(Lİ)** *sif.* Otuz mərtəbəsi olan. *Otuzmərtəbəli bina.*

**OTUZUNCU** "Otuz"dan *sıra s*. *Otuzuncu sıra. Otuzuncu ev.*

**OTYEYƏN** *sif.* Otla qidalanan. *Otyeyən heyvanlar.*

**OTYIĞAN** *is.* Biçilmiş otu yığan maşın, alət və s. // Sif. mənasında. *Otyığan maşın.*

**OV** *is.* 1. Vəhşi heyvan, quş vurma və ya tutma, həmçinin balıq tutma işi. *Ova getmək. Ov eləmək. Ovumuz uğurlu oldu. – Atam məni həmişə ova aparırdı.* M.Rzaquluzadə. ☐ **Ov heyvanı (quşu)** – ov üçün heyvan (və ya quş), ovlanan (quş). *Orada baş-başa vermiş qocaman ağaclar altında qiymətli ov heyvanları yatır.* H.Nəzərli. **Ov iti (tulası)** – ovçunun özü ilə ova apardığı xüsusi təlim görmüş it. *Eldarın tulası Xallı zahirən cins ov tulası idi.* M.Rzaquluzadə.

2. Ovda vurulmuş çöl heyvanı (quşu). *Ovu evə aparmaq. – Ov ətlərindən şişlik bişirmək üçün incə ətirli budaqlardan şişlər hazırlanmışdı.* M.Rzaquluzadə. // Tutulmuş balıq.

3. *məc.* Oğurluq, soyğunçuluq, talançılıq və s. yolu ilə ələ keçirilən hər şey; qənimət. *Neçə vaxt idi ki, bu lotuların əlinə bir ov keçmirdi.* "Aşıq Qərib".

**OVA** *is. dan.* Düzənlik, düzəngah, düzən yer; ovalıq. *Bizimdir bu əngin, atlas ovalar; Qoynunda qartal bəsləyən qayalar*. A.Şaiq. *Çöldə traktorun səsi canlanır; Ovalar şənlənir, həyəcanlanır.* S.Vurğun.

**OVAL** *is.* [*fr.*] Qabarıq, yumurtaşəkilli.

**OVALANMA** "Ovalanmaq"dan *f.is.*

**OVALANMAQ** b a x **ovulmaq**[1].

**OVALIQ** *is. coğr.* Dəniz səviyyəsindən aşağıda yerləşən düzənlik; hər hansı düzən yer; düzənlik. *Kür-Araz ovalığı. – Azərbaycan ərazisində geniş düzənliklər və ovalıq-*

*larla bərabər dərin dərələr və yüksək dağlar da vardır*. M.Qaşqay.

**OVCALAMA** *dan.* "Ovcalamaq"dan *f.is.*

**OVCALAMAQ** *dan.* b a x **ovuşdurmaq**. [Hidayət] *gülə-gülə gözünü ovcaladı*. B.Bayramov.

**OVÇU** *is.* 1. Ovla, ovçuluqla məşğul olan adam. *Ovçu tüfəngi. Həvəskar ovçu. – Ovçu yanında göz qırpmaq olmaz*. (Məsəl). *Ovçular qızılquş, tazı, tula götürüb ova çıxırlar.* A.Şaiq. [Milis müvəkkili Əzizə:] *..Silahınızı Ovçular İttifaqında qeydə aldırmısınız?* B.Bayramov. // *məc.* Obrazlı təşbehlərdə. *Ürək də ovçudur, ovlağı aləm; Hər zaman dolaşır, axtarır o da.* S.Vurğun. ☐ **Ovçu gözü (gözləri)** – iti görən, həssas, diqqətli gözlər haqqında. *Midhət göylərə baxdı. Ovçu gözləri göyün ənginliklərini seçir, sirli və dərin havanın içinə girə bilirdi.* Ə.Vəliyev. **Ovçu yuxusu** – sayıq yatan adamın yuxusu. *Ovçu yuxusu sayıq olar.* M.Rzaquluzadə.

**OVÇULUQ** *is.* 1. Ovçunun işi, peşəsi, məşğuliyyəti. [Şəmsi bəy:] *Piri baba, bunlar mənim ovçuluğumu lağa qoyub güldü, fəqət öz qüsurlarını açmaq istəmirlər.* S.S.Axundov. *Bu gün* [Buğac] *.. ovçuluq məharətini atasına da göstərəcək idi.* M.Rzaquluzadə.

2. Təsərrüfatın, ov heyvanları, xüsusilə xəz dərili heyvanlar ovlamaqla məşğul olan sahəsi. *Ovçuluq briqadası. – Burada ovçuluq da çox inkişaf etmişdir.* M.İbrahimov.

**OVÇUOTU** *is. bot.* Müxtəlif növləri olan sarı çiçəkli çəmən otu.

**OVDAN** *is.* [*fars.* ab-dan] Suyu yığıb saxlamaq üçün üstü tikili yeraltı hovuz, nohur. *Yağış suyu bu ovdana axırdı.* C.Cabbarlı. *Güdə Qala deyilən yüksəklik üzərindəki ovdanların yanında idik.* S.Hüseyn.

**OVDUQ** *is.* [*fars.* abduq] Ayran. [Qız] *kuzədən su töküb ovduq düzəltdi və Musa kişi ilə Firidunun qabağına qoydu.* M.İbrahimov. *Mirzə Alış ovduqdan stəkanlara doldurub onlara içirdirdi.* Ə.Vəliyev.

**OVXAQ** *sif.* Tez ovulan, kövrək.

**OVXALAMA** "Ovxalamaq"dan *f.is.*

**OVXALAMAQ** b a x **ovuşdurmaq**. *Beli ovxalamaq. – O, gündən qamaşan gözlərini ovxalayıb ətrafına baxdı.* M.Hüseyn. [Zəhra] *bir qədər gözlərini ovxaladı və dərhal geyindi.* Ə.Vəliyev.

**OVXALANMA** "Ovxalanmaq"dan *f.is.*

**OVXALANMAQ** 1. B a x **ovuşdurulmaq**.

2. Ovulub tökülmək. *Neçə-neçə varağın kənarı; İllərin ağırlığına dözməyib, ovxalanıb toz olub.* R.Rza.

**OVXALATMA** "Ovxalatmaq"dan *f.is.*

**OVXALATMAQ** b a x **ovuşdurmaq**. *Kürəyini ovxalatmaq.*

**OVXANTI** *is.* Ovuntu, qırıntı; ovulmuş, ovulub tökülmüş şeylər.

**OVQAT** *is.* [*ər.* "vəqt" söz. cəmi] 1. *klas.* Vaxt, zaman. *Bilmədin halını, bihudə keçirdin ovqat.* Füzuli. *Onunçün bir ovqat teleqrafları çap etməklə, gələcəkdə tazə bir qəzavüqədərə müntəzir olduq*. C.Məmmədquluzadə.

2. Əhval-ruhiyyə, ruhi vəziyyət, hal, kef. *Ovqatı qarışıqdır.* Mir Cəlal.

◊ **Ovqatına soğan doğramaq** *zar.* – kefini, əhvalını pozmaq. [Əşrəf bəy:] *İndi mən bilirəm, şəhərdə bu xeyir xəbər neçə adamın ovqatına soğan doğrayıb.* N.Vəzirov. **Ovqatı təlx** – kefi, əhvalı pozulmuş. *Axşam xan ovqatı təlx evə qayıtdı.* Çəmənzəminli. *Əmi ovqatı çox təlx evə gəldi*. N.Nərimanov.

**OVQATSIZ** *sif.* Kefi, əhvalı, pozğun, çox pərt, dilxor.

**OVQATTƏLXLİK** *is.* Pozğunluq, kefsizlik, pərtlik, dilxorluq. [Kor Seyid] *nə acı bir söz söyləyir, nə də ovqattəlxlik eləyir.* S.Hüseyn.

**OVLAQ** *is.* 1. Ov heyvanları və quşları çox olan yer, ov yeri. *Ovlaqda quş vurmaq. – Yoxsa ən yaxşı ovlaqdan da nabələd ovçu əli ətəyindən uzun qayıdar.* M.Rzaquluzadə. *İsi dayı .. ovlaqdan əlidolu qayıdanda bütün ağrı-acını unudardı.* B.Bayramov. // *məc.* Obrazlı təşbehlərdə. *Dağlar dağımdır mənim; Qəm ovlağımdır mənim.* (Bayatı). *Ürək də ovçudur, ovlağı aləm; Hər zaman dolaşır, axtarır o da.* S.Vurğun.

2. Heyvan və s.-nin daim olduğu, yaşadığı yer. *Belə deyirlər ki, guya o kahalar cin və şəyatin ovlağıdırlar.* N.Vəzirov. *Aslanların, pələnglərin ovlağıdır mənim yurdum*. S.Vurğun.

**OVLAMA** "Ovlamaq"dan *f.is.*

**OVLAMAQ** *f.* 1. Ov vurmaq, şikar etmək. *Dovşan ovlamaq*. – [Dəlilər] *səhərdən*

*kövşəndə ceyran ovlayırlar.* "Koroğlu". [Piri baba:] *Yasəmən, gör sənə nə kök qırqovul ovlamışam.* S.S.Axundov. // Balıq tutmaq.

2. *məc.* Çalmaq; ələ keçirmək, ələ gətirmək. [Tarxan:] *O gözəl qız, o ovçu, şux tərlan; Könlünü ovlamış sənin.* A.Şaiq. *Hər şeyi ovlamaq olsa da, məncə; Sevən könülləri ovlamaq olmaz.* M.Müşfiq.

**OVLANMA** "Ovlanmaq"dan *f.is.*

**OVLANMAQ** *məch.* Ov vurulmaq, şikar edilmək. *Çoxlu dovşan ovlandı.* // Balıq tutulmaq. *Hər gecə 40 sentner balıq ovlanmışdı.*

**OVMA**[1] 1. "Ovmaq[1]"dan *f.is.*

2. *sif.* Ovulmuş, narınlaşdırılmış, narın edilmiş. *Qarakişi .. iri-iri doğrayıb cibinə yığdığı qəzetdən bir parça çıxarıb arasına ovma tənbəki doldurdu.* B.Bayramov.

3. *is. məh.* Pendir ovuntusu ilə kərə yağı qatışığından ibarət yemək. *Çörəyi ovma ilə yemək. Ovma hazırlamaq.*

4. *is. məh.* Əldə toxunan yumşaq zərif parça. *Ovma toxumaq.*

**OVMA**[2] "Ovmaq[2]"dan *f.is.*

**OVMA**[3] *is. dan.* Geniş yayılmış yoluxucu xəstəlik.

**OVMACA** *is. məh.* Qarın ağrısı; sancı.

**OVMAFƏTİR** *is.* Çox ovuşdurulmuş bərk xəmirdən bişirilən və kəsərkən, yeyərkən asan ovulan kövrək fətir. *Ovmafətir bişirmək.* – [Xonça] *ibarətdir .. şəkərçörəyindən, ovmafətirdən və s. həlviyyatdan.* R.Əfəndiyev.

**OVMAQ**[1] *f.* 1. Ovulmuş hala salmaq, narın etmək, narınlaşdırmaq. *Maxorkanı ovmaq.* – *Xalıqverdi kişi köhnə məndulə kisədən tənbəki çıxarıb ovcunda ovdu.* Ə.Vəliyev.

2. Yuyub qazımaq (dağıtmaq), yuyub aparmaq, deşmək. *Yarğan yarar sinəsini dağların; Sular ovar binəsini dağların.* R.Rza. *On-on beş metr uzunluğunda güclü su şırnağı .. dağı ovub dağıdırdı.* Ə.Sadıq.

3. Dəlmək, qazımaq. *Dağların içini ovaraq bu tuneli açmışlar.* M.İbrahimov. // Bıçaq və b. ucuiti şeylə pozmaq, silmək, pozub görünməz etmək. *O sənin yazdığını; Ovub tökdü bıçaqla.* Z.Xəlil.

4. *məc.* Əzişdirmək, əzmək, əziyyət vermək. *Həyat* [Səriyyə və uşaqlarını] *şüursuz və iradəsiz bir cisim kimi öz təkərinin altına alıb əzməyə, ovmağa başladı.* M.İbrahimov.

**OVMAQ**[2] b a x **ovuşdurmaq**. [Camadar] *başladı mənim canımı ovmağa, sora da kisələməyə.* C.Məmmədquluzadə. *..Səriyyə gözlərini ovub ətrafa baxdı..* M.İbrahimov.

◊ **Burnunu ovmaq** – b a x **burun**.

**OVSAF** b a x **övsaf**.

**OVSANA: ovsanadan çıxarmaq** – edilən yaxşılığa, köməyə qiymət verməmək; unutmaq, qiymətdən salmaq. *Yaxşılığımı ovsanadan çıxardı.* **Ovsanaya düşmək** – vaxtı ilə edilən yaxşılığın, köməyin qarşılığını görmək, əvəzi çıxmaq, bədbəxt bir hadisədən, təsadüfdən, xatadan qurtarmaq; yerinə düşmək. *Tikəsi ovsanaya düşmək.* – [Məmiş:] *Odun yardığım yerdə qamqalaq dəydi, dərdin alım, bir çörəyim ovsanaya düşdü.* İ.Hüseynov.

**OVSAR** *is.* [*fars.*] Dəvə noxtası. *Dəvə tanınmasa, ovsarı tanınar.* (Ata. sözü). *Dağların başından keçəmmir karvan; Ovsarı əlində ağlayır sarvan.* "Koroğlu". *Bu çinarın dövrəsi ovsarları bir-birinə bağlanan dəvə karvanlarının, at-ulaqla yükdaşıyan çarvadarların düşərgə yeri olmuşdu.* S.Rəhimov.

**OVSARLAMA** "Ovsarlamaq"dan *f.is.*

**OVSARLAMAQ** *f.* 1. Dəvənin başına ovsar keçirmək, dəvəni noxtalamaq. *Dəvəni əvvəl ovsarla, sonra Allaha ismarla.* (Məsəl).

2. B a x **noxtalamaq** 2-ci mənada. *Lap bizi ovsarladılar, mindilər; Ay keçən əyyam, olasan indilər!* M.Ə.Sabir.

**OVSARLANMA** "Ovsarlanmaq"dan *f.is.*

**OVSARLANMAQ** *məch.* Başına noxta keçirilmək, noxtalanmaq. *Dəvə ovsarlandı.*

**OVSARLI** *sif.* Noxtalı, başında noxta olan (dəvə haqqında).

**OVSUN** *is.* [*fars.* əfsun] Sehr, cadu, pitik. *İlan əvvəl ovsun oxuyanı öldürər.* (Ata. sözü).

**OVSUNÇU** *is. köhn.* Ovsunçuluqla məşğul olan adam; cadugər, pitikçi. [Mürsəl:] *İlan ovsunçudan qorxan kimi* [Veysəl] *də məni görəndə dili girir qarnına.* Ə.Vəliyev.

**OVSUNÇULUQ** *is.* Ovsunçunun işi, peşəsi; cadugərlik, pitikçilik.

**OVSUNLAMA** "Ovsunlamaq"dan *f.is.*

**OVSUNLAMAQ** *f.* Mövhumatçıların təsəvvürüncə: ovsunla özünə tabe etmək, öz təsiri altına almaq. [Vahimə] *istəsə ilanı da ovsunlayıb yuvasından çıxardar.* B.Bayramov.

**OVSUNLANMA** “Ovsunlanmaq”dan *f.is.*

**OVSUNLANMAQ** *məch.* Mövhumatçıların təsəvvürüncə: ovsunla özünə tabe edilmək, təsiri altına alınmaq.

**OVSUNLU** *sif.* Ovsun edilmiş, sehirli, cadulu.

**OVŞALA** *is.* Su, şəkər və sirkədən (və ya limon turşusundan) hazırlanan sərinlədici içki; şərbət. *Ovşala içmək. – Bir kasada şərbət, içində balaca stəkan qoyulardı. Ona ovşala deyərdilər*. H.Sarabski. [Bir muzdur:] *Amma o biri aşlarda ovşala qayırıb yanına qoyardılar, ya da iskəncəbi*. Ə.Əbülhəsən.

**OVŞAR** *is. dan.* Sağımdan əvvəl heyvanların, əsasən qaramalın əmcəklərini sığallama, ovuşdurma. □ **Ovşara gətirmək** – b a x **ovşarlamaq**. *Gülüstan* [inəyi] *yavaşıtmaq və ovşara gətirmək üçün oxşayırdı: – Nənəm, a Mərcan inək; Bacım, a Mərcan inək!..* Ə.Abasov.

**OVŞARLAMA** “Ovşarlamaq”dan *f.is. Ovşarlama üsulu ilə sağmaq nəticəsində Həcər arvad hamıdan tez, hamıdan çox süd sağırdı.* Ə.Vəliyev.

**OVŞARLAMAQ** *f.* Sağımdan əvvəl heyvanların, əsasən qaramalın əmcəklərini sığallamaq, ovuşdurmaq, ovşara gətirmək. *Bu arvad inəyi adi sağıcılar kimi sağmır, ovşarlayırdı.* Ə.Vəliyev.

**OVUC** *is.* 1. Əlin barmaqlar və ayadan ibarət hissəsi, əlin içi. *Ovcunda saxlamaq. – ..Mən ixtiyarsız ovcumu açdım və quşcuğaz da şad bir səslə uçub getdi.* S.S.Axundov. [Yaşlı kişi:] *Ovcumu soyuq su ilə doldurub sinəsini və döşlərini islatdım.* S.Hüseyn. // *məc.* “Əl” mənasında. [İsgəndər:] *Gərək hər əmrimə baş əysin cahan; Ovcumda top kimi oynasın dövran.* A.Şaiq.

2. Ovuc tutan qədər, ovuca yerləşən miqdar (adətən saylarla). *İki ovuc buğda.*

◊ **Ovuc (ovcun) içi kimi (tək)** – aydın, aşkar, yaxşı. *Ovcumun içi tək görürəm aydın; Bir şey yayınmayır nəzərlərimdən.* B.Vahabzadə.

**ovuc-ovuc** *sif.* və *zərf* Ovuclayaraq, ovuclarla, ovuc dolusu. [Nəbi:] *Ovuc-ovuc içək düşmən qanını*. “Qaçaq Nəbi”. *Yayda mən ovuc-ovuc su içmişəm doyunca; Sənin barmaq donduran şır-şır bulaqlarından.* S.Rüstəm.

**OVUCLAMA** “Ovuclamaq”dan *f.is.*

**OVUCLAMAQ** *f.* Ovucla götürmək, ovcunu ya ovuclarını doldurub götürmək. *Arpanı ovuclamaq. – Suyu bulaq gözündən ovuclayıb içməyə öyrəşmiş mən bu təmli, qazlı suları içə bilmirdim.* Ə.Məmmədxanlı. *Əmrah sarı buğdanı ovuclayıb yuxarıdan sanki hamı görsün deyə yenə kisəyə tökür.* Q.İlkin.

**OVUCLANMA** “Ovuclanmaq”dan *f.is.*

**OVUCLANMAQ** *məch.* Ovucla götürülmək.

**OVUCU** *is.* Ovan, masajçı.

**OVUQ** *is.* 1. Ovulmuş, oyulmuş yer; koğuş. *Dələ ovuqda gizləndi. Divardakı ovuq. – Axdı göz yaşı tək soyuq damlalar; Sehirli daşların ovuqlarından.* M.Dilbazi.

2. Ovuntu. *Yoldaşı cibindən bir az qənd ovuğu çıxardıb deyir.* “M.N.lətif.”

**OVUQLU** *sif.* Ovuğu olan, koğuşlu. *Ovuqlu ağac. Ovuqlu qaya.*

**OVULMA¹** “Ovulmaq¹”dan *f.is.*

**OVULMA²** “Ovulmaq²”dan *f.is.*

**OVULMAQ¹** 1. *məch.* Narınlaşdırılmaq, narın edilmək, ovuq hala salınmaq. *Kisədəki tənbəki ovulmuşdur.*

2. Ovulub tökülmək.

**OVULMAQ²** b a x **ovuşdurulmaq**.

◊ **Burnu ovulmaq** – b a x **burun**.

**OVUM** b a x **ovuntu**.

**OVUNDURMA** “Ovundurmaq”dan *f.is.*

**OVUNDURMAQ** *f.* Sakitləşdirmək, təskin etmək, təskinlik vermək, ovutmaq. *Aslan uşaqların başını dizi üstünə qoyub ovundurmağa çalışırdı.* C.Cabbarlı. [Fərhad:] *Səni ovundurmaq üçün o, söz tapa bilmir.* Ə.Məmmədxanlı.

**OVUNDURUCU** *sif.* Sakitləşdirici, təskinedici, ovuducu.

**OVUNMA** “Ovunmaq”dan *f.is.*

**OVUNMAQ** *f.* Sakitləşmək, təskinlik tapmaq, təsəlli tapmaq. [Yanardağ:] *Acıqlı Əhrimən elimizə çox acıqlanmış, nə qədər adi qurbanlar verilirsə, ovunmur.* C.Cabbarlı. *Anası ona təsəlli verirdisə, Dilara ovunmurdu.* Ə.Məmmədxanlı.

**OVUNMAZ** *sif.* Heç bir şeylə təskinlik tapmayan, ovunmayan, sakitləşməyən, rahatlanmayan.

**OVUNTU** *top.* Bir şeyin ovulmuş hissəcikləri, qırıntıları. *Çörək ovuntusu. Ağac ovuntusu. Qənd ovuntusu. Mərmər ovuntusu. – İndi sərçələr ovuntuları səylə dənləyirdilər.* H.Seyidbəyli.

**OVURD** b a x **ord**. *Nəriman əmi ovurdlarını şişirdərək, əlini bığına çəkib məzəmmətlə Murada baxdı..* İ.Əfəndiyev.

◊ **Ovurdları batıq** – çox arıq, zəif. *..Balaca, ovurdları batıq qoca Fərəculla dilləndi.* S.Rəhimov. **Ovurdları batmaq (bir-birindən keçmək)** – son dərəcə arıqlamaq, narın edilmək, ovuq hala salınmaq. [Mürsəlin] *ovurdları bir-birindən keçmiş, boğazı uzanmışdı.* Ə.Vəliyev.

**OVURTDAQ** *sif. dan.* Sifəti koppuş, kök. *Ovurtdaq hesabdar içini arıtlayaraq özündən razı bir sifətlə stolun arxasına keçdi.* S.Rəhimov.

**OVUŞDURMA** "Ovuşdurmaq"dan *f.is.*

**OVUŞDURMAQ** *f.* 1. Bədənin hər hansı bir yerini barmaqları ilə sıxmaq, əzişdirmək; əlini gəzdirib ovucla sıxmaq, ovmaq; masaj eləmək. *Üzünü ovuşdurmaq. – Şeyda alnını ovuşduraraq düşüncəyə dalar.* H.Cavid. *Ovuşdurub bir az o əllərini; Əmr etdi qoşuna: – Vurun birbaşa!* H.K.Sanılı.

2. Masaj etmək, ovmaq. *Bədənini ovuşdurmaq.*

3. Müalicə məqsədilə bədənin bir yerini yağlı dərmanlar və s. sürtməklə ovmaq. *Kamfora sürtərək ovuşdurmaq. Ayağını qarla ovuşdurmaq.*

**OVUŞDURULMA** "Ovuşdurulmaq"dan *f.is.*

**OVUŞDURULMAQ** *məch.* Masaj edilmək; ovulmaq.

**OVUŞUQ** *sif.* Ovxalanmış, ovulmuş, əzilmiş, əzik.

**OVUTMA** "Ovutmaq"dan *f.is.*

**OVUTMAQ** b a x **ovundurmaq**. *Uşağı ovutmaq. Xəstəni ovutmaq. – Çıx buludlardan, ey əfsanəli qız! Gəl ovut ruhumu, ey şən yıldız!* H.Cavid. [Səməd:] *Bacıoğlu qoymaz ki, məni incitsinlər, – deyə özünü ovutdu.* B.Talıblı.

**OY** b a x **ay²** 2-ci mənada. [Xanım:] *Oy, nə qədər qorxuncsunuz, ya rəbbi! – dedi.* H.Nəzərli. [Gülçöhrə:] *Oy, qorxdum a...* Ü.Hacıbəyov.

**OYADICI** *sif.* Oyadan, təsir edən, doğuran, törədici. *İştahaoyadıcı dərmanlar.*

**OYAQ** *sif.* 1. Yatmamış, yuxulamamış, yuxuya getməmiş. *Kim yatmış, kim oyaq?* – [Miraxur Səfərə:] *Yuxuda boğazıma kəmsik salıb məni boğmaq istəyiblər. Yaxşı ki, sən oyaq imişsən.* Çəmənzəminli. [Türbət İmamyara:] *Bu gecə qonaqlıqdır, adamlar hamısı oyaq olacaq..* C.Cabbarlı.

2. *məc.* Ehtiyatlı, ehtiyatkar, ayıq, sayıq. *Çox oyaq adamdır.*

**OYAQLIQ** *is.* 1. Yuxuda olmayan adamın halı; oyaq. ☐ **Yuxu ilə oyaqlıq arasında** – yarıyuxulu halda. *Mansur dizi üstə oturub baxırdısa da, heç bir şey görməyib yuxu ilə oyaqlıq arasında idi.* C.Cabbarlı. *İndi də* [xan] *kabusdan qurtarmayıb oğlunun hər bir hərəkətindən diksinir, .. yuxu ilə oyaqlıq arasında idi.* M.Rzaquluzadə.

2. *məc.* Ehtiyatlılıq, ehtiyatkarlıq, ayıqlıq, sayıqlıq. *Əsil oyaqlıq indi tələb olunur.* Ə.Vəliyev.

**OYALAMAQ** *f.* Qurdalamaq, qarışdırmaq, altını üstünə çevirmək.

**OYANDIRICI** b a x **oyadıcı**.

**OYANDIRMA** "Oyandırmaq"dan *f.is.*

**OYANDIRMAQ** 1. Oyatmaq, yuxudan durğuzmaq. *Uşağı oyandırmaq.*

2. *məc.* Hərəkətə gətirmək, doğurmaq, törətmək, qızışdırmaq, gücləndirmək. *Dəfn edin siz məni Zabul segahın mayəsinə; Deyirəm, bəlkə, məni bir gün oyandırdı muğam.* B.Vahabzadə.

**OYANIQ** b a x **oyaq**.

**OYANIQLIQ** b a x **oyaqlıq**. [Cəmil bəy:] *Hər uyuyan oyandığı zaman başı ucunda sənin kimi bir mələk görəcəyini düşünsəydi, şübhəsiz, uyumağı, oyanıqlığa tərcih edərdi.* H.Cavid.

**OYANIŞ** *is.* Oyanma; oyanma işi. *Buludlar parçalanır, torpaq buğlanır, otlar baş qaldırır, quşlar civildəşməyə başlayırdı. Bu, bir oyanış idi.* M.İbrahimov.

**OYANMA** "Oyanmaq"dan *f.is.*

**OYANMAQ** *f.* 1. Yuxudan ayılmaq, gözlərini açmaq. *Sübh tezdən yuxudan oyanan kimi eşitdim, .. rəiyyətin birinin evində qilüqal səsi gəlir.* C.Məmmədquluzadə. *Nənə*

*dərin yuxusundan; Xeyli vaxtdır oyanmışdır.* M.Dilbazi.

2. *məc.* Canlanmaq, hərəkətə gəlmək. *Kənd oyandı. – Tikintidə artıq həyat oyanırdı.* Ə.Sadıq. // *məc.* Cana gəlmək, canlanmaq, dirilmək, inkişafa başlamaq. *Hər şeydə fərəh, sevinc, təravət; Artıq oyanıb gülür təbiət.* A.Şaiq. *Bəzi yerlərdə torpaq yenicə oyanır, taxıllar boy atmağa başlayırlar.* M.İbrahimov.

3. *məc.* Gözü açılmaq, qəflət yuxusundan ayılmaq, hərəkətə gəlmək. *Məzlum siniflər oyandı.*

4. *məc.* Əmələ gəlmək, doğmaq, törəmək. *Birdən-birə məndə bağçaya baxmaq həvəsi oyandı.* M.İbrahimov. *Zeynəbin qəlbində qayğı və mərhəmət hissi oyandı.* İ.Şıxlı.

5. *məc.* Özünü tanımaq, özündə kişilik əlamətləri hiss etməyə başlamaq.

**OYATMA** "Oyatmaq"dan *f.is.*

**OYATMAQ** *f.* 1. Yuxudan durğuzmaq, oyandırmaq, oyanmasına səbəb olmaq, oyanmağa məcbur etmək. *Bir gün sübh tezdən Pərinisə yuxudan ayılıb başladı Kərbəlayı Məhəmmədəlini təpikləyib oyatmağa.* C.Məmmədquluzadə. *..Ümid anasını oyadıb onunla birlikdə Sədəfin atası evinə getdi.* B.Bayramov.

2. *məc.* Canlandırmaq, diriltmək, həyat vermək. [Kolxozçular] *torpağı təzədən qazıb oyatdılar, ona yeni toxumlar atdılar.* Ə.Məmmədxanlı.

3. *məc.* Qəflət yuxusundan ayıltmaq, gözünü açmaq, hərəkətə gətirmək. "*Molla Nəsrəddin*" *xalqın şüurunu oyadırdı, cəsarət və hərəkətə gətirirdi.* M.İbrahimov. *Qoca Şərqi yuxusundan Bakı oyatmış.* R.Rza.

4. *məc.* Törətmək, əmələ gətirmək, doğdurmaq, yaratmaq. [Vaqif:] *Mədinə, bilsən bu rəngin payız meşəsi məndə nə qədər dərd oyadır.* Çəmənzəminli.

**OYDURMA** "Oydurmaq"dan *f.is.*

**OYDURMAQ** *icb.* 1. Oyuq açdırmaq, qazdırmaq.

**OYKONİM** *is.* [*yun.*] Yaşayış məntəqələrinin adını bildirən xüsusi isimlər; sözlər.

**OYLAQ** *is.* 1. Məskən, yer, meydan. [Aşıq Cünun:] *Mərd oylağı Çənlibeldi; Məhbub xanım, bizim yerlər.* "Koroğlu". *Qıjıltı, gurultu tutur qulağı; Buradır köhnədən qaçaq oylağı.* H.K.Sanılı. *Şairlər vətəni bizim tərəflər; Tərlanın oylağı yadıma düşdü.* S.Vurğun. // Obrazlı təşbehlərdə. *Könlüm oylağını yaxın gəzəli; Çoxları küsəndi mana, bənövşə!* S.Vurğun. *Yazda, payızda, qışda gülür çəmənim, bağım; Dəmir köksümsə çoxdan vuruşlar oylağıdır.* S.Rüstəm.

2. Düzənlik, geniş sahə. *Sərin olur yaylaqları yurdumun; Vardır geniş oylaqları yurdumun.* Aşıq Bəylər. *Genişdir oylağı, gendir meydanı; Yenəndə çaylağa dağın dumanı.* S.Vurğun.

**OYMA**[1] 1. "Oymaq[1]"dan *f.is.*

2. *is.* Ağac, daş, sümük, metal və s. üzərinə həkk olunan və ya oyulmaqla açılan bəzək, zinət, naxış. *Oyma dəzgahı.*

**OYMA**[2] "Oymaq[2]"dan *f.is.*

**OYMAÇI** *is.* Oyma ustası (b a x **oyma**[1] 2-ci mənada).

**OYMAÇILIQ** *is.* Oymaçı sənəti, oyma işləri ilə məşğul olma (b a x **oyma**[1] 2-ci mənada).

**OYMAQ**[1] b a x **ovmaq**[1] 2-ci mənada. *Su axarkən yeri oyub çuxurlar, oyuqlar əmələ gətirərdi.* S.S.Axundov.

**OYMAQ**[2] b a x **ovuşdurmaq**. [Kərəm:] *Mən baxardım, didarından doyardım; Gizlin-gizlin bağrım başın oyardım.* "Əsli və Kərəm". *Bəylərbəyinin övrəti Şahnavaz xanım* [Münəvvərin] *alnını oyub huşa gətirmək istəyirdi.* M.S.Ordubadi.

**OYMAQ**[3] *is.* Tikiş tikərkən iynə batmamaq üçün barmağa keçirilən bir ucu bağlı metal və ya başqa materialdan qalpaqcıq; üskük.

**OYMAQ**[4] *is. köhn.* Kənd, el. [Quldurlardan biri:] *Niyə, bir oymağın adamları deyilikmi?* Ə.Haqverdiyev. *Səfər əslən Qılınclar oymağından olub uşaqlığını kənddə keçirmişdi.* Çəmənzəminli.

**OYNAĞAN** *sif.* və *is.* Çox oynayan, daim oynayan, oynamağı sevən; oynaq. *Oynağan yorulmaz.* (Ata. sözü). *Qəlbə fərəh verən şirin muraddır; Nəşəmiz oynağan bir şux Qıratdır.* M.Rahim.

**OYNAQ**[1] *sif.* 1. Mütəhərrik, oynar, oynayan, daim hərəkətdə olan. *O baxışlarda dalğadan oynaq; Bir şəfəq var ki, nurdan şəffaf!*

A.Şaiq. [Elxan:] ..*Qaldıracağım azadlıq bayrağının oynaq dalğaları* [Solmazın] *gülgün çöhrəsini öpəcəkdir.* C.Cabbarlı.

2. Oynağan, şux. *Qapı laybalay açıldı. Gülər ürkək və oynaq bir dağ keçisi kimi irəli yeridi*. C.Cabbarlı. *Sən mənim köhlənim, oynaq atımsan; Mənim yaman gündə ehtiyatımsan.* M.Müşfiq. // *məc.* Şux, şən, gümrah. *Həmişə sərt görünən Mərdan indi oynaq bir hal alaraq nəşə saçırdı*. Çəmənzəminli. // *məc.* Cilvəli, işvəkar, şux. *Oynaq qız. – Elə bil ki, lap təzəcə toy eləmiş; Cavandılar; Necə oynaq, necə şıltaq; Mehribandılar.* B.Vahabzadə.

3. *məc.* İfadəli, təsirli, canlı; danışığa, sözə, üsluba yüngüllük, oynaqlıq, gözəllik verən. *Oynaq dil. Oynaq ifadələr.* – [Cabbarlının] *əsərlərindəki qanadlı sözlər, oynaq cümlələr dillərdə dolaşırdı*. S.Rəhman.

**OYNAQ²** *is. anat*. Buğum, məfsəl.

**OYNAQ³** b a x **oylaq**. *Tərpətdi düzlərlə Qanığa tərəf; Qaçaqlar oynağı Samuxa tərəf.* H.K.Sanılı. *Şirnuxu kəndinin yanında, Nəbi ilə Həcərin oynaqlarından birisi olan Şırlanbulağın yanında, sıx palıdlı meşədə düşdük.* S.Rəhimov.

**OYNAQLAMA** "Oynaqlamaq"dan *f.is.*

**OYNAQLAMAQ** *f.* Atılıb-düşmək, oynamaq. *Quzular oynaqlayır. – Gedək görək uşaqlar; Bağda nə cür oynaqlar.* A.Səhhət. *Buynuzu burma təkə oynaqlayır, atılıb-düşürdü.* S.Rəhimov.

**OYNAQLAŞMA** "Oynaqlaşmaq"dan *f.is.*

**OYNAQLAŞMAQ** *qarş.* Birgə atılıb-düşmək, bir yerdə oynamaq (çoxları haqqında). *Uşaqlar oynaqlaşırlar. – Kəndin ötəsində-bərisində yumurtadan yeni çıxmış cücələr, oynaqlaşan oğlaqlar görünür..* S.Hüseyn.

**OYNAQLIQ** *is.* 1. Oynaq şeyin halı; mütəhərriklik, qərarsızlıq. *Payız havasının oynaqlığındanmı, yoxsa Bakı ilə buranın arasındakı məsafənin uzaq olmasındanmı, nə isə hava xeyli dəyişmişdi.* M.Rzaquluzadə.

2. Daim oynaqlama, atılıb-düşmə, oynama xasiyyəti; qərarsızlıq. [Dilbər] *bir saniyə üçün keçmiş uşaq oynaqlığı ilə Məryəmin üzərinə atılmaq, qucmaq, öpmək istədi, amma dayandı.* C.Cabbarlı.

3. *məc.* Şuxluq, işvəkarlıq.

4. *məc.* İfadəlilik, gözəllik, yüngüllük, canlılıq. *Nitqin oynaqlığı.*

**OYNAMA** "Oynamaq"dan *f.is.*

**OYNAMAQ** *f.* 1. Oyuncaqla, yaxud əyləncə üçün olan oyunlardan biri ilə məşğul olmaq, onunla vaxtını keçirmək; əylənmək. *Qaçdı-tutdu oynamaq. Gəlinciklə oynamaq. Uşaq bütün günü oynayır. – Uşaq vaxtı küçədə aşıq-aşıq oynayanda hərdənbir savaşardıq*. C.Məmmədquluzadə. *Rəhilə dərsdən çox yaşıdları ilə oynamağı xoşlayırdı*. M.Hüseyn. // İstirahət və ya əylənmək məqsədilə idman növlərindən biri ilə məşğul olmaq. *Şahmat oynamaq. Bilyard oynamaq. Nərd oynamaq*. // Oynamaq üçün bir şeydən istifadə etmək. *Topla oynamaq*. // *məc.* Bir şeylə qeyri-ciddi məşğul olmaq, özünü işləyən kimi göstərmək. *O şiləmir, oynayır*. // *məc.* Boş vaxt keçirmək, vaxtını öldürmək, boş şeylərlə məşğul olmaq, əylənmək. ..*Mən həyata oynamağa gəlmirəm.* Mir Cəlal.

2. Bir şeylə oyuncaq kimi rəftar etmək, bir şeyi məqsədsiz olaraq əlində oynatmaq, fırlatmaq və s. *Açarla oynamaq. Əlindəki qaşıqla oynamaq. – ..Sona .. başından siyrilib çiyninə düşən ağ torunun ipək saçaqları ilə oynayırdı.* Ə.Əbülhəsən. // *məc.* Bir şəxsə və ya şeyə oyuncaq, əyləncə kimi baxmaq, birinin arzu və iradəsi ilə hesablaşmayaraq onunla istədiyi kimi rəftar etmək. *Adamlarla oynamaq olmaz. Əsəbləri ilə oynamaq*. // Əylənmək, özü üçün oyuncağa, əyləncəyə döndərmək. *Şirzad anladı ki, Yarməmməd mənliyi ilə oynayır.* M.İbrahimov.

3. B a x **oynaşmaq**. // *məc.* Sürətlə o tərəf-bu tərəfə hərəkət etmək, hərəkət edərək tərpənmək. *Dənizdə dalğalar oynayır.*

4. *məc.* Şəfəqlənərək, bir şeyin üzərində, yaxud bir şeydən inikas etmək, parlamaq, bərq vurmaq. *Kənd üzərində günün al şəfəqləri oynayırdı.* M.Hüseyn. // Sayrışmaq. *Göydə ulduzlar oynayır.*

5. Təzahür etmək, görünmək, görsənmək, görünüb yox olmaq. *Böyük bir maraqla açılan gözlərdə indi hədd-hüdudu olmayan bir təşviş və həyəcan kölgələri oynayırdı.* Ə.Əbülhəsən.

6. Rəqs etmək. *Yallı oynamaq. Vals oynamaq. – Başına döndüyüm, toy adamları; Siz*

*də deyin: toya gələn oynasın.* M.P.Vaqif. *Rəqqasə ərəb qızları oynar və ara-sıra oxuyarlar.* H.Cavid.

7. Teatr tamaşasında, kinoda, pyesdə və s.-də müəyyən rolu ifa etmək. *Qəhrəman rolunda kim oynayır?* // Tamaşaya qoymaq, göstərmək. *Teatrda M.F.Axundzadənin "Hacı Qara" pyesini oynayırlar.*

8. Bir sıra isimlərdən sonra gətirilərək, mürəkkəb feil və müxtəlif ifadələr düzəldilir; məs.: yerindən oynamaq, rol oynamaq, sözlə oynamaq, oyun oynamaq və s.

**oynaya-oynaya** *zərf* 1. Oynayaraq, oynamaq vəziyyətində, rəqs edə-edə. *Oynaya-oynaya oxumaq. – Aşıq .. balabançı ilə çiyin-çiyinə verib oynaya-oynaya ortada hərlənirdi.* İ.Əfəndiyev.

2. *məc.* Asanlıqla, heç bir çətinlik çəkmədən. *Tapşırığı oynaya-oynaya yerinə yetirmək.*

3. *məc.* Böyük həvəslə, məmnuniyyətlə, sevinə-sevinə. [Pəri:] [Ataş] *hansına bircə dəfə göz eləsən, oynaya-oynaya gələr.* Ə.Vəliyev.

**OYNANILMA** "Oynanılmaq"dan *f.is.*

**OYNANILMAQ** "Oynamaq"dan *məch. Bir otaqdan nərdin şaqqıltısı eşidilir, o biri otaqda gərgin sükut içində şahmat oynanılırdı.* M.Rzaquluzadə.

**OYNANMA** "Oynanmaq"dan *f.is.*

**OYNANMAQ** b a x **oynanılmaq**. *Tamaşanın ikinci pərdəsi oynanırdı.* Mir Cəlal.

**OYNAR** *sif.* 1. Oynayan, bir yerdə durmayan, qərar tapmayan, daim hərəkətdə olan, tərpənən.

2. Rəqqas, kəfgir (saatda).

3. *məc.* Oynaq (b a x **oynaq**[1] 2-ci mənada).

**OYNARLIQ** *is.* 1. Oynaq şeyin hal və keyfiyyəti.

2. Oynaqlıq (3-cü mənada).

**OYNAŞ** b a x **aşna** 2-ci mənada. *Oynaşa ümid olan ərsiz qalar*. (Ata. sözü). [Məsmə:] [Ərim] *elə zənn edirdi ki, guya mənim yanıma gələn oynaşlarım var imiş.* S.Hüseyn.

**OYNAŞMA** "Oynaşmaq"dan *f.is.*

**OYNAŞMAQ** *qarş.* 1. Bir-biri ilə oynamaq; əylənmək. *İki çəlimsiz körpə çarpayının üstündə oynaşırdı..* Çəmənzəminli. *..Oynaşan .. uşaqlara tamaşa etməkdən doymazdım.* Mir Cəlal. // Eyni mənada heyvanlar, quşlar və s. haqqında. *Quzular, çəpişlər həyətdə oynaşır. – Xəzan yarpaqları oynaşan yerdə; Necə üşüməyim?.. Üşüyürəm mən.* B.Vahabzadə. // Müxtəlif tərəflərə uçmaq və ya üzmək. *Kəpənəklər oynaşır. – Mərmər hovuzlarda qızıl balıqlar oynaşırdı.* Çəmənzəminli. *Sarıköynəklər, qaranquşlar qayalar arasında oynaşır, kollar arasında itirlər.* Mir Cəlal.

2. *məc.* İrəli-geri gedib-gəlmək, hərəkət etmək; tərpəşmək, ləpələnmək. [Sonanın] *xumarlanan gözləri oynaşan* (f.sif.) *dalğalara zillənmişdi.* B.Bayramov.

3. *məc.* Təzahür etmək, görünmək. *Füzuli əyləşib otağında tək; Oynaşır üzündə qəm buludları*. B.Vahabzadə.

4. *məc.* Görünüb yox olmaq, sayrışmaq, işığı əks etdirmək. *Projektor işıqları hər zamankı kimi yenə limanın üzərində oynaşır, küçələri işıqlandırırdı.* S.Vəliyev. *İşıq titrədikcə* [Qaragünənin] *qaya parçası kimi hərəkətsiz üzündə əcaib kölgələr oynaşır, .. sonra yenə donub qayaya dönürdü.* M.Rzaquluzadə.

**OYNATDIRMA** "Oynatdırmaq"dan *f.is.*

**OYNATDIRMAQ** *icb.* Oynamağa məcbur etmək. *Bəzən mötəbər adamların oğlunu yerindən qaldırıb toyda oynatdırardı.* H.Sarabski.

**OYNATMA** "Oynatmaq"dan *f.is.*

**OYNATMAQ** *f.* 1. Uşağı əlinə alaraq, atıb-tutaraq əyləndirmək, yaxud oyuncaq və başqa vasitələrlə məşğul etmək və beləliklə, özü də əylənmək. *Körpəni oynatmaq. Uşaqları oynatmaq. – Vahid uşağı yanına alıb oynadır, dilə tutub yatırtmaq istəyirdi.* Mir Cəlal. // Oyuncaq və s. ilə oynamaq, məşğul olmaq. *Gəlinciyi oynatmaq. – Müəllimlə Mayis getdikdən sonra da Tapdıq maşını oynatmaqdan doymurdu.* Ə.Vəliyev. [Qız] *küncdə oturub gəlin oynadarmış*. Çəmənzəminli.

2. O tərəf-bu tərəfə tərpətmək, qımıldatmaq. [Qızıl it] *qulaqlarını oynadaraq qalın, boğuq səsi ilə hürər, nəşəmi pozardı*. A.Şaiq. *Ayaqlarımı soyuq suya salıb oynatmağa başladım.* A.Divanbəyoğlu. // Tərpətmək. *Kələntər qara qaşlarının altındakı qara gözlərini oynatdı*. M.İbrahimov.

3. *icb.* Oynamağa məcbur etmək, rəqs etdirmək. *Vağzalı oynatmaq.*

4. Əlində atıb-tutmaq, fırlatmaq. [Doktor:] *Hə, de anamın oğluyam, verim, – deyib, konfeti əlində oynadardı*. M.İbrahimov. [Hidayət] *əlində oynatdığı sarı yarpağı .. kənara fırlatdı*. B.Bayramov.

5. *məc*. Göstərmək, təzahür etdirmək. *Şahnisə xanım yarı çevrilərək dodaqlarında mənalı bir təbəssüm oynatdı*. Çəmənzəminli.

6. *məc*. Ələ salmaq, dolamaq, sarımaq. [Şamama Cadu:] *Sən belə güman etmə ki, sən məni oynadırsan deyibsən, mən də səni ələ salıb oynadıram*. Ə.Haqverdiyev. [Elçi:] *Məni oynatmaq olmaz*. C.Cabbarlı. // *məc*. Aldatmaq, aldadaraq yormaq; yuxulatmaq. *İki aydır ki, məni oynadır*.

7. *məc*. Yerindən eləmək. *Yaxşı və dəbdəbəli toy qıza nağıl kimi maraqlı görünür, bütün xəyalını oynadırdı*. M.İbrahimov.

**OYROTCA** *sif*. və *zərf* Oyrot dilində; altayca.

**OYROTLAR** *cəm*. Altaylıların köhnə adı.

**OYUQ**[1] *is*. 1. Oyulmuş yer; mağara, kaha. *Qayaların oyuğunda yuva salar kəsəyənlər*. O.Sarıvəlli. *Kəklikli qayanın sinəsində iki böyük daş parçalanıb uçmuş, .. dərin oyuqlar açılmışdı*. B.Bayramov.

2. Bir şeyin üzərində dərmə-deşik, deşik, dəlik. *Sanki çay daşların oyuqlarını, ağacların köklərini bu ucdan eşir və yerin tərkinə gedirdi*. S.Rəhimov. // Çuxur, çala. *Su axarkən yeri oyub, çuxurlar, oyuqlar əmələ gətirərdi*. S.S.Axundov.

3. *sif*. İçi oyulmuş, içi oyuq, boşluq əmələ gəlmiş. *Dərə qərbə doğru getdikcə qayalıq, dağlıq, iri və oyuq daşlarla dolu qorxunc yerlərdən ibarətdi*. A.Şaiq. // Gövdənin oduncağı çürümüş yerində əmələ gələn boşluq; koğuş. *Meşənin içində, bir ağacın oyuğunda pişik göyərçini gizlətdi*. (Nağıl).

4. Divarda pəncərə, qapı və s.-nin yeri. *Pəncərə oyuğu*.

**OYUQ**[2] b a x **qorxuluq** 2-ci mənada. *Yolun üst tərəfi qoruq idi. Bir neçə yerdə oyuq qoyulmuşdu*. Ə.Vəliyev.

**OYUQLU** *sif*. 1. Oyuqları olan. *Yoxsa xəyalında canlanır yenə; Sıldırım qayalar, oyuqlu dağlar*. R.Rza.

2. Oyuğu olan, deşik, dəlik. *Oyuqlu daş*. // Koğuşu olan, koğuşlu. *Oyuqlu ağac*.

**OYULMA** "Oyulmaq"dan *f.is*.

**OYULMAQ** *f*. Oyuq əmələ gəlmək.

**OYUN** *is*. 1. Əylənmək və vaxt keçirmək üçün bir neçə adam (əsasən uşaq) arasında icra olunan müxtəlif növlü əyləncə, məşğələ. *Qaçdı-tutdu oyunu. Gəlin-gəlin oyunu. – Belə maraqlı oyunlardan biri də xalq arasında kosaldıqaç* (*kos aldın qaç*) *adı ilə məşhur olan oyundur*. H.Sarabski.

2. Müəyyən qayda, üsul və şərtlərlə icra edilən idman məşğələsi, idman növü. *Şahmat oyunu. Basketbol oyunu. – Zorxanaya kim yazılsaydı, gərək hər gün oyuna gələydi*. H.Sarabski. □ **Oyun kağızı** – kart, qumar kağızı. *Hənirtisiz ora yaxınlaşan Veys tez əyilib, oyun kağızlarından bir topa götürdü..* Ə.Əbülhəsən. // Görüş, yarış, matç. *Rəqib komandaların oyunu. Oyun saat 6-da başlanır*.

3. Rəqs. *Oyun havası. Vağzalı. oyunu. – Oyuna tək girən oğlan .. gözaltı elədiyi qızın qabağına yeriyir, .. onu oyuna dəvət edir*. B.Bayramov.

4. *məc*. Hoqqa, kələk, fənd, fırıldaq, hiylə. [İkinci kəndli:] *Bu qədər oyun olmaz ki, Səfər bəy bizim başımıza gətirir*. B.Talıblı. *Səba xanım başladığı oyunun müsbət nəticə verəcəyinə ümid bəsləmirdi*. M.S.Ordubadi.

5. Müəyyən rolu oynama, ifa eləmə. *Artistin oyunu tamaşaçıların xoşuna gəldi*.

◊ **Oyun tutmaq** – b a x **başına oyun gətirmək** ("**baş**"da). [Ağa Həsən:] *Yaxşı, sənə mən bir oyun tutum ki, tamam dastanlarda deyilsin*. M.F.Axundzadə. [Ələsgər:] *And olsun Allaha, sənə bir oyun tutacağam ki, atanın toyu yadına düşə*. Ə.Haqverdiyev. **Oyun çıxar(t)maq** – 1) hoqqa çıxarmaq, gülməli hərəkətlər etmək (atılıb-düşmək, hoppanmaq və s.). [Təlxək] *üzünə dəridən bir üzlük taxıb aşağıda oyun çıxarar və yamsılamaqla pul yığardı*. H.Sarabski. [Təlxək] *başlayır oyun çıxarmağa, gülməsək də, bir az kefimiz açılır*. S.Rəhman; 2) *məc*. bir işlə qeyri-ciddi məşğul olmaq, zarafata salmaq. *Oyun çıxar*(*t*)*ma, işinə fikir ver!* **Başına oyun açmaq** – b a x **baş**. **Başına oyun gətirmək** – b a x **baş**.

**OYUNBAZ** *is*. 1. Gülməli oyunlar çıxarıb başqalarını güldürən adam; hoqqabaz, oyun çıxaran, masqaraçı. *Adamlar özlərinə məzəli*

*təlxək, oyunbaz, ya dəli düzəldib əylənir, meydançanı, bazarı yeni gülüşmə götürürdü.* S.Rəhimov.

2. Keçmişdə ruhanilərin və mürtəcelərin artistlərə verdikləri təhqirli ad. [Səməd Oqtaya:] [Ananı] *yasxanalara buraxmırlar ki, oğlun oyunbazdır, arvad tumanı geyir.* C.Cabbarlı.

3. *məc.* Fırıldaqçı, hiyləbaz, kələkbaz. [Həsən:] *Bu oyunbazların əlindən nələr çəkmişəm, onu bir tək mən bilirəm.* Ə.Haqverdiyev. [Əhməd:] *Nədən ötrü məni axtarırsan, ay hiyləbaz, kəndirbaz, oyunbaz, kəkilbaz?* N.Vəzirov.

**OYUNBAZXANA** *is.* Keçmişdə ruhanilərin və mürtəcelərin teatra verdikləri təhqiramiz ad. [Qafar:] *..Səni teatra aparım? Oyunbazxanaya?* S.S.Axundov.

**OYUNBAZLIQ** *is.* 1. Müxtəlif gülməli oyunlar göstərmə; hoqqabazlıq. *Məclis arəstə, ortalıqda bir sandıqça, içi dolu ilan, ilanları göstərib dərvişlər başladılar oyunbazlığa.* N.Vəzirov.

2. *məc.* Kələkbazlıq, fırıldaqçılıq, fəndgirlik. [Nəcəf:] *Nə qədər gec deyil, oyunbazlıqdan əl çək!* Q.İlkin.

**OYUNCAQ** *is.* 1. Uşaqların oynayıb əylənməsi üçün düzəldilmiş hər cür şey. *Uşaq oyuncağı. Oyuncaq mağazası. – Sarı o biri otaqdan oyuncaqlarla əyləndirib saxladığı Çiçəyi buraxdı.* S.Rəhimov. *Səhər gün çıxandan gün batanadək uşaqlar oynar, ev tikər, palçıqdan oyuncaq düzəldərdilər.* Q.İlkin. // *məc.* Oynamaq, əylənmək üçün obyekt olan hər bir şey. [Bəhram:] *Saray olmuş bir oyuncaq; Meydan açır oğul-uşaq.* A.Şaiq.

2. *məc.* Kor-koruna başqasının iradəsi ilə oturub-duran, öz müstəqil fikri olmayan adam haqqında. [Molla Güləndam mütəəlliməyə:] *..Mən sənin oyuncağın deyiləm ki, məni ələ salasan.* Çəmənzəminli. ◻ **Oyuncaq hökumət** – başqa, daha güclü hökumət tərəfindən hakimiyyət başına gətirilən və ölkəni onun iradəsi ilə idarə edən hökumət.

◊ **Əlində oyuncaq etmək** – b a x **əl. Əlində oyuncaq olmaq** – b a x **əl**.

**OYUNÇU** *is.* 1. Hər hansı oyunda iştirak edən adamlardan hər biri. *Oyunçular sıraya düzüldülər. Məşqçinin oyunçulara göstərişi.* – [Oğlan:] *Rəhmətlik oğlu, sən .. oyunçu deyilsən, odunçusan.* Ə.Haqverdiyev.

2. Rəqs edən, rəqqas(ə). *Oyunçu* (sif.) *qız ləzginka oynayır.* Ü.Hacıbəyov.

3. B a x **oyunbaz** 1-ci mənada. [Həsən:] *Rus oyunçularından əlli manatımın otuz səkkizini alınca anadan əmdiyim süd burnumdan gəldi.* Ə.Haqverdiyev.

**OYUN-OYUNCAQ** *top.* Müxtəlif oyuncaq(lar). *Edison uşaqlıq vaxtını başqa uşaqlar kimi yalnız oyun-oyuncaq ilə keçirməmişdi.* "Məktəb". // b a x **oyuncaq** 2-ci mənada. [Molla Güləndam mütəəllimeyə:] *..Mən sənin oyun-oyuncağın deyiləm ki, məni ələ salırsan?* Çəmənzəminli.

**OZAN** *is.* 1. *qəd.* El şairi, aşıq. [Elçin:] *Bu cəngavər ozanın yarasını bağlayın tez!* M.Hüseyn. *Nə ozan var, nə yazan, nə şaman hey... Qoca Türkün düşdüyü dərd yaman hey...* A.İldırım.

2. *məc.* Çoxdanışan, lağlağı, uzunçu, naqqal. *Sən keçən yolda görərək bir iz; İzin üstündə ozana döndüm!* Ə.Cavad.

**OZANLAMA** "Ozanlamaq"dan *f.is.*

**OZANLAMAQ** *f. köhn.* Uzunçuluq etmək, çərənçilik etmək.

**OZANLIQ** *is.* Ozanın işi, peşəsi; aşıqlıq.

**OZON** [*yun.* ozo – ətir saçıram] Oksigenin dəyişilmiş şəkli olub, qüvvətli oksidləşdirici və zərərsizləşdirici xassəyə malik qaz.

**OZONÁTOR** [*yun.*] Havanı ozonlaşdırmaq (təmizləmək) üçün cihaz.

**OZONLAŞDIRMA** "Ozonlaşdırmaq"dan *f.is.*

**OZONLAŞDIRMAQ** *f.* 1. *kim.* Ozona çevirmək.

2. Ozonla təmizləmək. *Suyu ozonlaşdırmaq. Havanı ozonlaşdırmaq.*

**OZONLAŞMA** "Ozonlaşmaq"dan *f.is.*

**OZONLAŞMAQ** *f.* 1. *kim.* Ozona çevrilmək.

2. Ozonla təmizlənmək.

# Öö

**Ö** Azərbaycan əlifbasının iyirmi ikinci hərfi. // "Ö" hərfi ilə işarə olunan saitin adı.

**ÖC** *is.* İntiqam. [Tərxan:] *Qaynayır qəlbimin içində öcüm; Bilirəm, çatmaz o nəhəngə gücüm.* A.Şaiq. ☐ **Öc almaq** – intiqam almaq. *..Yenə Kəpəzin ağsaçlı məğrur başı vüqarla ucalır, sanki işıq qaranlıqdan öc alırdı.* M.Rzaquluzadə.

**ÖCƏŞKƏN** *sif.* Öcəşməyi, sürtüşməyi sevən, mübahisə etməyi sevən. *Öcəşkən adam.*

**ÖCƏŞKƏNLİK** *is.* Öcəşməyi adət etmiş adamın xasiyyəti. *Öcəşkənlik yaxşı şey deyil.*

**ÖCƏŞMƏ** "Öcəşmək"dən *f.is.* [Vaqif Şahnisəyə:] *Xülasə, gecə-gündüz bu xanların bir-biri ilə öcəşməsindən heç başımız ayazımır.* Çəmənzəminli.

**ÖCƏŞMƏK** *f.* Çəkişmək, sataşmaq, sürtüşmək, mübahisə etmək, tutaşmaq. [Rzaqulu:] *Qoy o məni yaxşı tanısın, mənə öcəşməsin, xataya salmasın..* N.Vəzirov. [Əbülhəsən bəy:] *Çəkməsilən mənimlə öcəşməyə və məni ələ salmağa başlamışdı.* M.S.Ordubadi.

**ÖD** *is.* 1. Qara ciyərin ifraz etdiyi sarı-yaşıl rəngli acı maye. ☐ **Öd kisəsi** – qara ciyərdə olan və öd ifraz edən kisəyəoxşar orqan; ödlük. **Öd şirəsi** – öd kisəsinin ifraz etdiyi maye; öd. *Yem qursaqdan nazik bağırsağa daxil olan kimi onun üzərinə hiss-hissə mədəaltı şirəsi və öd şirəsi süzülür.* "Qaramal".

2. *məc.* Çox acı şey haqqında. *Öd kimi.*

◊ **Ödü ağzına gəlmək** – iyrənməkdən, başı gicəllənməkdən qusmaq dərəcəsinə gəlmək, ürəyi bərk bulanmaq, bərk iyrənmək. *Üfunətdən adamın ödü ağzına gəlir.*

**ÖDDƏK** *sif. məh.* Qorxaq.

**ÖDƏK** *is. məh.* Ödənməli plan, qaytarılmalı olan pul; borc. [Əlləzoğlu:] *Mən bu qədər ödəyin altından necə çıxacağam?* İ.Hüseynov.

**ÖDƏMƏ** "Ödəmək"dən *f.is.*

**ÖDƏMƏK** *f.* 1. Başqasından aldığı, yaxud borc etdiyi şeyi qaytarmaq, vermək. *Həsən çəkmə pulunu iki aya qədər ödəyə biləcək idi.* Çəmənzəminli. [Rüstəm kişi] *borclarını ödədi və hər əməkgününə üç kilo taxıl payladı.* M.İbrahimov.

2. Təmin etmək. [Gənc:] *Üç ay tədarük olunan hərarət ölkənin doqquz aylıq ehtiyacını tamamilə ödəyir.* Çəmənzəminli. *Əvvəlki maaşından az maaş alarsa, komitə onun kəsrini ödəyəcəkdir.* M.S.Ordubadi. // Bəs etmək, yetmək, çatmaq, kifayət etmək. *Maaşı məxaricini ödəyir.* – [Bəhlul:] *Mənim təqaüdüm ev kirayəsini ödəyirdi..* B.Bayramov.

3. Öhdəsinə götürmüş olduğu bir şeyi yerinə yetirmək. *Planı artıqlamasilə ödəmək.*

**ÖDƏNİLMƏ** "Ödənilmək"dən *f.is.*

**ÖDƏNİLMƏK** "Ödəmək"dən *məch. Borc ödənildi. Bütün ehtiyaclar ödənildi. – Məcəllə hökmüylə xatırlanan borc; Yaxşıdır min dəfə ödənilməsə.* B.Vahabzadə.

**ÖDƏNİŞ** *is.* 1. Ödənmə işi; ödənmə. *Borcun ödənişi.*

2. Yerinə yetirilmə. *Planın ödənişi.*

**ÖDƏNMƏ** "Ödənmək"dən *f.is.*

**ÖDƏNMƏK** b a x **ödənilmək**. *Borc ödəndi.*

**ÖDƏYİŞ** *is.* Borcunu vermə, ödəmə.

**ÖDLÜK** *is.* b a x **öd kisəsi** ("**öd**"də).

**ÖDÜL** *is.* Mükafat, priz.

**ÖDÜNC** *is.* Əvəzi eyni və ya bənzər şeylə verilmək (qaytarılmaq) şərtilə alınan şey (əsasən pul); borc.

**ÖFKƏ** *is.* 1. Ağ ciyər.

2. *dan.* Hirs, qəzəb, hiddət.

◊ **Öfkən (öfkəsi) yansın!** – qarğış məqamında işlədilir. *Səni görüm, öfkən yansın.* – [Telli:] *Məni qınayan, öfkən yansın!* Ə.Məmmədxanlı. **Öfkəyə dönmək** – rəngi qaçmaq, ağarmaq. *Katibin qanı qaçmış, öfkəyə dönmüş dodaqları gülümsünmək üçün aralandı.* S.Rəhimov. *Bəhramın dili-dodağı təpmiş, üzünün qanı qaçmış, öfkəyə dönmüşdü.* Ə.Vəliyev.

**ÖFKƏLƏNMƏ** "Öfkələnmək"dən *f.is.*

**ÖFKƏLƏNMƏK** *f.* Hirslənmək, hiddətlənmək, qəzəblənmək, hiddətə gəlmək.

**ÖFKƏLİ** *sif.* 1. Ürəkli, qorxmaz, cəsarətli, ciyərli. *Öfkəli oğlan.*

2. *dan.* Hirsli, qəzəbli, hiddətli, acıqlı. *Mühasib, Əbişin bu hala düşməyindən və*

*Kosanın bu cürə öfkəli hökm etməyindən bu teleqramı öyrənməyə daha da artıq maraqlandı*. S.Rəhimov.

**öfkəli-öfkəli** *zərf* Hirsli-hirsli, qəzəbli-qəzəbli, qəzəblə, hirslə, hiddətlə. [Murtuzov:] *Yoxsa bu uşaq belə öfkəli-öfkəli danışmaz!* S.Rəhimov. [Paşa bəy:] *Çox da öfkəli-öfkəli danışma!* Ə.Vəliyev.

**ÖGEY** *sif.* Doğma olmayan. *Ögey ana. Ögey ata. Ögey bacı*. – *Uşaq anasına doğma olsa da; Qondarma ataya ögeydir, axı.* B.Vahabzadə.

**ÖGEY-DOĞMALIQ** *is.* Hamıya qarşı eyni münasibətin olmadığı hal; ayrı-seçkilik. *Araya ögey-doğmalıq salmaq. – Bəli, elədir, – deyə mən Nəbi kişinin sözünü təsdiq etdim: – Yoxsa ögey-doğmalıq olar*. S.Rəhimov. *Deyən, əkizlərlə gəldi bərabər; Poladın evinə ögey-doğmalıq*. M.Rahim.

**ÖGEYLİK** *is.* Doğma olmama, ögey olma. *Mənə neçə qadın analıq etdi; Dözdülər anasız məhəbbətimə; Mən isə dözmədim ana adıyla; Onların ögeylik sədaqətinə.* S.Tahir.

**ÖGƏC** *is.* Üçyaşar erkək qoyun. *Toğlu birillik, şişək ikiillik, ögəc üçillik olardı*. H.Sarabski.

**ÖHDƏ** *is.* [*ər.*] Öz üzərinə götürülən və yerinə yetirilməsi vacib olan vəzifə; təəhhüd, borc. ☐ **Öhdəsində qalmaq** – himayəsində, iaşəsində olmaq, boynunda olmaq. [Nuriyyə:] *Ata-anamın vəfatından sonra səkkiz yaşında bir uşaq öhdəsində qaldım.* İ.Əfəndiyev. **Öhdəsində olmaq** – bir vəzifə olaraq üzərində olmaq, boynunda olmaq; ixtiyarında, idarəsində olmaq. [Məktəblərin] *xərci dövlət xəzinəsinin öhdəsində idi*. C.Məmmədquluzadə. *Körpü xüsusi tapşırıq ilə Nərimanın dəstəsinin öhdəsində idi*. Mir Cəlal. **Öhdəsindən gəlmək** – 1) bir işi yerinə yetirməyə gücü çatmaq, edə bilmək, bacarmaq. *Vəzifənin öhdəsindən gəlmək. – Mehriban bu çətin işin öhdəsindən gələ biləcəkdimi?* H.Seyidbəyli. [Xanım:] *Mən dedim o, bu işin öhdəsindən gələ bilməz*. M.Dilbazi; 2) mübarizədə və ya başqa bir işdə üstün gəlmək, bacara bilmək, gücü çatmaq. [Kərbəlayı Fatma xanım:] *Mən hacının öhdəsindən gələ bilmirəm..* C.Məmmədquluzadə. [Çərkəz bəy:] [Camaatın] *öhdəsindən gələ bilməyirəm..* Ə.Haqverdiyev. // *məc*. Dərsini vermək, divan tutmaq. *Onun öhdəsindən yaxşı gəldilər*. **Öhdəsinə qoymaq (buraxmaq, atmaq)** – birinin boynuna qoymaq, üzərinə qoymaq, tapşırmaq. *Məsuliyyəti başqasının öhdəsinə qoymaq* (*buraxmaq*). – [Pristav:] *Turaclılarla haqq-hesab çəkməyi qoy mənim öhdəmə*. Ə.Vəliyev. *Babacan .. evin iş-gücünü həmişəlik qızının öhdəsinə atmışdı.* Ə.Əbülhəsən. **Öhdəsinə düşmək** – üzərinə düşmək, boynunda olmaq, yerinə yetirilməli olmaq. [Fəxrəddin:] *Öz boynumu öhdəmə düşən məsuliyyətdən kənara çəkmək istəmirəm*. M.S.Ordubadi. **Öhdəsinə götürmək (almaq)** – yerinə yetirməyi bir vəzifə olaraq boynuna götürmək, boyun olmaq, söz vermək, üzərinə götürmək. [Məhərrəm bəy:] *Əlbəttə, hər bir xərci öhdəmə götürürəm..* S.S.Axundov.

**ÖHDƏÇİ** *is.* Hər hansı bir işi görməyə, yerinə yetirməyə söz verən, üzərinə təəhhüd götürən adam.

**ÖHDƏÇİLİK** bax **öhdəlik**. *Bütün trestimiz üzərinə yeni öhdəçiliklər götürür*. M.İbrahimov. [Fərəc kişi:] *İndi də öhdəçilik götürüblər ki, biçini iki günə qurtarsınlar.* Q.İlkin.

**ÖHDƏLİK** *is.* Mütləq yerinə yetirilməli olan iş; öhdəçilik. *Üzərinə öhdəlik götürmək. Öhdəlik şərəflə yerinə yetirildi.*

**ÖHÖ, ÖHÖ-ÖHÖ** *təql*. Öskürərkən çıxan səs.

**ÖKCƏ** *is.* Ayaqqabı altının topuq altına düşən hündür hissəsi; daban.

**ÖKSÜZ** *is.* 1. Yetim. *Ta uşaqlıqdan öksüz qalmış Gülzar öz kor anası ilə yoxsul qardaşı Aslanın himayəsində yaşayırdı*. C.Cabbarlı. // *məc*. Kimsəsiz, baxımsız. *Öksüz uşaq.*

2. *məc.* Uğursuz, bədbəxt, talesiz. *Əsrinin öksüzüdür dahilər*. H.Cavid. *Öksüz taleyimtək gecikdin nədən? Karvanqıran doğdu, görünmədin sən.* C.Cabbarlı.

**ÖKSÜZLÜK** *is.* Yetimlik. // Kimsəsizlik. *Baxdım ki, sürünməyin sonu yoxdur, buraxdım; Qapadım bir məzara öksüzlüyün daşını.* A.İldırım.

**ÖKÜZ** *is.* 1. İş heyvanı kimi istifadə edilən buğa. *Təpəl öküz. Öküzləri arabaya qoşmaq.*

– *..Kiçik çobanlar öküzlərə minib, malları evə sarı qovurdular.* H.Nəzərli. *Güneyləri şumlamaq üçün kotana öküz qoşurdular.* B.Bayramov.

2. *məc.* Çox yekə, nahamar, zorba adam haqqında. // *məc*. Qaba, kobud, qanmaz adam haqqında.

◊ **Öküzün böyüyü pəyədədir** *zar.* – işin çətini hələ daldadır, cəncəl hələ qurtarmayıb. [Sara bibi:] *Hələ öküzün böyüyü pəyədədir.* Qantəmir.

**ÖKÜZGÖZÜ** *is. bot*. Sarı çiçəkləri təbabətdə işlədilən ot bitkisi.

**ÖKÜZLÜK** *is.* Yekəlik, nahamarlıq, zorbalıq (adam haqqında). // *məc*. Qabalıq, kobudluq, qanmazlıq.

**ÖLÇDÜRMƏ** "Ölçdürmək"dən *f.is.*

**ÖLÇDÜRMƏK** *icb.* Ölçməyə məcbur etmək, yaxud xahiş edərək ölçmə işi gördürmək.

**ÖLÇMƏ** "Ölçmək"dən *f.is.*

**ÖLÇMƏK** *f.* 1. Bir şeyin ölçüsünü, miqdarını qəbul olunmuş vahidlər əsasında müəyyən etmək, müəyyənləşdirmək. *Südü ölçmək. Parçanı ölçmək. Otağın kvadraturasını ölçmək. Qızdırmasını ölçmək. – İstisini ölçüb dərhal; Ana deyir: – Dincəl bir az.* M.Dilbazi.

2. Mülahizə etmək, çıxış etmək, müqayisə etmək, tutuşdurmaq. *Hər şeyi öz düşüncəsi ilə ölçmək.*

3. *məc. dan.* Vurmaq, gopamaq, çəkmək, ilişdirmək. *Suyun gah soyuq və gah istiliyindən narazı olaraq* [Məşədi Qulam] *yaş əllərilə Cavahirin başına ölçərdi*. T.Ş.Simurq.

4. B a x **ölçüb-biçmək** 2-ci mənada. *Sözünü ölç. Hərəkətlərini ölç.*

◊ **Əllərini ölçmək** – b a x **əl**. **Yüz ölç, bir biç** – "bir iş görərkən qabaqca yaxşı-yaxşı, hərtərəfli fikirləş" mənasında ifadə. **Küçələri ölçmək** – avara-avara gəzmək, veyil-veyil gəzmək, veyillənmək. **Öz arşını ilə ölçmək** – bir adam və ya şey haqqında öz şəxsi baxımından, birtərəfli mühakimə yürütmək.

**ÖLÇÜ** *is.* 1. Hər hansı bir şeyi ölçmək üçün qəbul edilmiş vahid. *Uzunluq ölçüsü. Həcm ölçüsü*.

2. *məc.* Bir şəxsə, ya şeyə qiymət vermək, müqayisə etmək üçün əsas götürülən şey. *..Bu dünyada hər hansı qiymətin ölçüsü zəhmətdir.* S.Rəhimov.

3. Hər hansı bir şeyin müəyyən vahidlər əsasında təyin edilən böyüklüyü, kiçikliyi, biçimi, həcmi, dərəcəsi. *Qızların hamısının libası bir qiymətdə, bir əndazədə və bir ölçüdə idi.* M.S.Ordubadi. *Buruqların dörd tərəfində müxtəlif ölçüdə neftli, mazutlu borular, dəmir və taxta parçaları gözə dəyirdi.* M.İbrahimov. // Hüdud, hədd, sərhəd, çərçivə. *Xüsusən gəncliyin arzuları göylərdəki ulduzlar qədər sayılmaz və ölçüyə yerləşməzdir*. M.S.Ordubadi. *Zaman və məkan yenidən öz həqiqi ölçüsünə qayıdırdı*. Ə.Məmmədxanlı.

4. Ölçmə işi; ölçmə. *Sahədə ölçü işləri aparılır.*

5. B a x **vəzn** 2-ci mənada. *Şerin ölçüsü.*

6. *məc. dan.* Əhatə dairəsi, görüş dairəsi. [Şirzad Rüstəmə:] *Sən dar düşünürsən, ölçün balacadır.* M.İbrahimov.

◊ **Ölçü götürmək** – tədbir görmək. *Əvvəlcə Müqim bəy əla dərəcəli meyvəcatın Şuşa qalasına göndərilməsi üçün ölçü götürdü.* S.Rəhimov. *Tərlanov, Teymur Cahangirov haqqında ölçü götürəcəyinə söz verdi*. H.Seyidbəyli. **Ölçüyə gəlməmək** – çox böyük, həddən artıq yekə, ölçülə bilməyən şey haqqında. *Din ilə ucalır ruhumuz göyə; Göylər bir qiyasa, ölçüyə gəlməz.* B.Vahabzadə.

**ÖLÇÜ-BİÇİ** b a x **ölçü** 1 və 3-cü mənalarda. *Kənd əhalisi isə uzun illər boyu müxtəlif ölçü-biçidə olan damlarda və qazmalarda yaşayırdı.* S.Rəhimov.

◊ **Ölçü-biçi bilməmək** – 1) nə etdiyini, nə dediyini bilməmək, hədd-hüdud bilməmək, həddini aşmaq. *Hərəkətlərində ölçü-biçi bilməmək. – Bilməyir heç bu ağız ölçü-biçi; Hey ötür, sanki sınıb bəndi, piçi.* Ə.Nəzmi; 2) ölçüyə gəlməmək, ölçüsü olmamaq, həddi-hüdudu olmamaq. *İnsan xəyalının ölçü-biçi bilməyən sürəti* [Həcəri] *götürdü*. S.Rəhimov.

**ÖLÇÜB-BİÇMƏ** "Ölçüb-biçmək"dən *f.is.*

**ÖLÇÜB-BİÇMƏK** *f.* 1. Tikiləcək paltarın və s.-nin ölçüsünü götürmək və bu ölçüyə əsasən parçasını kəsmək.

2. *məc.* Götür-qoy etmək, hərtərəfli fikirləşmək. *Ölçüb-biçib nəticə çıxarmaq*. – [Gözəl] *düşünməli, ölçüb-biçməli, cavab verməli*

*idi*. Ə.Vəliyev. *Hidayət, kişinin bu vəziyyətində ona verəcəyi cavabı ölçüb-biçmədi.* B.Bayramov.

**ÖLÇÜCÜ** *is. xüs*. Ölçən, bir şeyin ölçüsünü müəyyən edən cihaz, alət və s. // Sif. mənasında. *Ölçücü cihazlar*.

**ÖLÇÜLMƏ** "Ölçülmək"dən *f.is. Taxılın ölçülməsi. Sahənin ölçülməsi. Paltarın ölçülməsi*.

**ÖLÇÜLMƏK** "Ölçmək"dən *məch. İnsanın qiyməti onun qabiliyyəti və əxlaqı ilə ölçülür. – Vəzni, dərəcəsi hər bir hörmətin; Zəhmətlə ölçülür vətənimizdə.* B.Vahabzadə.

**ÖLÇÜLMƏZ** bax **ölçüyəgəlməz**.

**ÖLÇÜLMƏZLİK** bax **ölçüyəgəlməzlik**.

**ÖLÇÜLÜ** *sif.* Ölçüsü olan.

**ÖLÇÜLÜB-BİÇİLMƏ** "Ölçülüb-biçilmək"dən *f.is.*

**ÖLÇÜLÜB-BİÇİLMƏK** *məch.* Hərtərəfli düşünülmək, götür-qoy edilmək.

**ÖLÇÜLÜB-BİÇİLMİŞ** *f.sif.* Hərtərəfli düşünülmüş, hərtərəfli düşünüldükdən sonra qəbul edilmiş. *Ölçülüb-biçilmiş qərar.*

**ÖLÇÜSÜZ** *sif.* Ölçüsü olmayan; çox böyük, geniş, ölçüyəgəlməz. *Həyat ona nə böyük; Nə ölçüsüz* (z.) *görünür; Birdən qapıda əziz; Mehriban üz görünür.* R.Rza. ◻ **Ölçüsüz corab** – müəyyən ölçüsü olmayıb hər bir ayağa gələn elastik corab.

**ÖLÇÜSÜZ-BİÇİMSİZ** *zərf* Ölçüb-biçmədən, götür-qoy etmədən, fikirləşmədən. [Hacı Əliqulu] *ölçüsüz-biçimsiz söz danışan adam deyil.* Qantəmir.

**ÖLÇÜSÜZLÜK** *is.* Ölçüsü olmama; çox böyüklük, ölçüyəgəlməzlik.

**ÖLÇÜYƏGƏLMƏZ** *sif.* Heç bir ölçü ilə ölçülə bilməyən; çox böyük, saysız-hesabsız, çox yekə, ucsuz-bucaqsız. *Ölçüyəgəlməz miqdar. Ölçüyəgəlməz sahə.*

**ÖLÇÜYƏGƏLMƏZLİK** *is.* Heç bir ölçü ilə ölçülə bilməmə; son dərəcə çoxluq, böyüklük, irilik, ölçülməzlik.

**ÖLDÜ-QALDI** *is.* Başına gələn hadisə; tale, aqibət. [Hacı Murad:] *..Öldü-qaldısından da xəbərim yoxdur*. S.S.Axundov. *..Alagözün öldü-qaldısından xanıma səhih bir xəbər gətirə bilmirdi*. S.Rəhimov.

**ÖLDÜRMƏ** "Öldürmək"dən *f.is.*

**ÖLDÜRMƏK** *f.* 1. Cismən məhv etmək, həyatdan məhrum etmək, ölümünə səbəb olmaq; qətl etmək. ..[Mələyin] *sevimli nişanlısını .. gecə oğurluqda öldürmüşdülər.* A.Divanbəyoğlu.

2. *məc.* Çox yormaq, çox üzmək, əziyyət vermək, əldən salmaq, incitmək, çox əzab və cəfa vermək. *Bu yol lap məni öldürdü. Tər məni öldürdü.*

3. *məc.* Mənən sarsıtmaq, tamamilə ruhdan salmaq, çox ağır təsir etmək. *Bu acı xəbər bizi öldürdü. Bir kəlmə söz onu öldürdü. Onun fikri məni öldürür.*

4. Puça çıxarmaq, puç eləmək, boş yerə sərf etmək; itirmək. *Vaxtını öldürmək. – Sənət yaxşı şeydir. Sənət sahibi vaxtını boş öldürməz.* Ə.Sadıq.

5. **Öldürsən də, öldürsəniz də, öldürsələr də, öldürsəydin də** və i.a. şəklində – əsla, qətiyyən, heç bir vəchlə. *Öldürsən də deməyəcəyəm. Öldürsələr də gedən deyiləm. – ..Bir müsəlman ki, bir rus məclisinə düşərdi, öldürsəydin də bir qətrə də içki dilinə vurmazdı.* C.Məmmədquluzadə.

6. Bir sıra isimlərdən sonra gələrək, müxtəlif tərkib və ifadələr düzəldilir; məs.: özünü öldürmək, nəfsini öldürmək, ruhunu öldürmək.

◊ **Ölüb-öldürməyə çıxmaq** – ölümlə nəticələnə bilən davaya başlamaq, bir-birini öldürmək dərəcəsinə gəlmək. *Olmadılar razı onu bölməyə; Çıxdı iş axır ölüb-öldürməyə.* A.Səhhət.

**ÖLDÜRTMƏ** "Öldürtmək"dən *f.is.*

**ÖLDÜRTMƏK** *icb.* Öldürülməsinə səbəb və ya vasitə olmaq, başqasının əli ilə öldürmək. [Çopur:] *Mən çox nahaq qanlara fitva verib adam öldürtmüşəm.* S.Hüseyn.

**ÖLDÜRÜCÜ** *sif.* 1. Ölümlə nəticələnə bilən, ya nəticələnən; məhvedici, yoxedici, həlakedici. *Öldürücü zəhər. Günəş şüaları bakteriyalara öldürücü təsir göstərir.*

2. *məc.* Son dərəcə ağır; dözülməz, müdhiş. *Öldürücü zərbə.*

3. *məc.* Kəskin, amansız. *Öldürücü tənqid. Öldürücü söz. – "Molla Nəsrəddin" in gülüşü kəskin bir gülüş, öldürücü bir satira idi..* M.İbrahimov. *Telli əllərini belinə qoyub dayandı, Səlimin üzünə öldürücü nəzərlə baxmağa başladı*. S.Rəhman.

**ÖLDÜRÜLMƏ** "Öldürülmək"dən *f.is.*

**ÖLDÜRÜLMƏK** *məch.* Cismən məhv edilmək, yox edilmək, aradan qaldırılmaq, qətl edilmək.

**ÖLƏT** *is. köhn.* Öldürücü xəstəlik epidemiyası. [Hacı Qara:] *Heç kəs malın üzünə baxmır. Deyəsən, ölətdən qırılanların sovxasıdır.* M.F.Axundzadə. // Söyüş məqamında. [Yasavul:] *Bəs niyə öldürmədin o öləti?* S.Rəhimov.

**ÖLƏZİK** *sif. məh.* Alovu azalmağa, sönməyə başlamış; sönmüş, közərmiş.

**ÖLƏZİMƏ** "Öləzimək"dən *f.is.*

**ÖLƏZİMƏK** *f. məh.* Alovu sönməyə, közərməyə başlamaq; işarmaq, közərmək. *Karvansaranın bir tərəfində qalanmış ocaq gah yanır, gah öləziyirdi.* Ə.Vəliyev. // Zəifləmək, azalmaq (işıq haqqında). *Mənzilə ölgün bir işıq süzülür, yavaş-yavaş öləziyirdi.* Ə.Vəliyev. *Get-gedə ocaq öləziyir, sazaq güclənir, ara vermiş qar indi qum kimi ələnirdi.* B.Bayramov.

**ÖLGÜN** *sif.* Canlılığı, təzəliyi, təravəti qalmamış; düşkün, solğun. *İyirmi beş bahar görmüş bu adam altmış xəzan keçirmiş qoca kimi yorğun, xəstəhal və ölgün* (z.) *görünürdü.* A.Şaiq. *Aynada* [Züleyxanın] *sifəti çox ölgün* (z.) *görünürdü.* S.Rəhimov. // *məc.* Cansız, ölmüş kimi görünən. *Bir saat əvvəl səssizlikdən ölgün kimi görünən təbiət birdən-birə canlanır.* A.Şaiq. // *məc.* Zəif, solğun, sönük. *Kiçik bir lampanın ziyası evə xəstə və ölgün bir işıq nəşr edirdi.* S.Hüseyn. *Yolun kənarlarında qazma daxmalardan ölgün çıraq işığı gəlir, qapılarda ucadan itlər hürüşürdü.* M.Hüseyn.

**ÖLGÜNLƏŞMƏ** "Ölgünləşmək"dən *f.is.*

**ÖLGÜNLƏŞMƏK** *f.* Ölgün hala gəlmək, ölgün kimi görünmək. *Divardakı əcaib şəkillər Məşuqənin gözlərində ölgünləşirdi.* S.Rəhimov. *Yay günəşinin istisindən ölgünləşib, başını aşağı dikmiş yarpaqlar indicə tərpənib həzin-həzin səslənirdi.* B.Bayramov.

**ÖLGÜNLÜK** *is.* 1. Ölgün şeyin halı.

2. *məc.* Fəaliyyətsizlik, durğunluq, həyat əsərinin olmadığı hal. *Şəhərin ölgünlüyünə baxmayaraq, yalnız bu zavod canlıdır.* H.Nəzərli.

**ÖLKƏ** *is.* 1. Məmləkət, diyar; yer, ərazi. *İsti ölkələr. Mərkəzi Afrikadakı ölkələr. Ölkə bütün dağlıqdır. – Var isticə ölkələr; Qışda bizə xoş gələr.* A.Səhhət. [Vaqif:] *Nadir ölkədə sağ yer qoymadı, hər yer xarabaya döndü.* Çəmənzəminli.

2. Bir dövlətin idarəsi altında olan yerlər; dövlət. *Qonşu ölkələr. Xalq demokratiyası ölkələri. Yaxın Şərq ölkələri. Xarici ölkələrlə dostluq əlaqəsi.*

3. Tərkibində muxtar vilayət olan böyük inzibati-ərazi bölgü. *Krasnodar ölkəsi. Primorsk ölkəsi.*

**ÖLKƏDAŞ** *is.* Bir ölkənin vətəndaşı olan adamlardan hər biri.

**ÖLKƏŞÜNAS** *is.* Ölkəşünaslıq mütəxəssisi. *Ölkəşünasların qurultayı.*

**ÖLKƏŞÜNASLIQ** *is.* Hər hansı bir ölkənin və ya onun müəyyən yerinin, rayonunun təbiəti, tarixi, iqtisadiyyatı və s. haqqındakı biliklərin məcmusu. *Ölkəşünaslıq muzeyi.*

**ÖLMƏ** "Ölmək"dən *f.is.*

**ÖLMƏ-DİRİL** *zərf dan.* Zorla-güclə, gücbəla ilə, əziyyətlə, zillətlə, çətinliklə. *Ölmə-diril yaşamaq. – Payızı və qışı ölmə-diril başa vurmuş kəndlilər yazın gəlməsini dördgözlə gözləyirdilər.* Ə.Vəliyev.

**ÖLMƏK** *f.* 1. Həyatı tərk etmək, vəfat etmək; keçinmək. *..Evin kişisi bir neçə il bundan qabaq ölmüşdür.* C.Məmmədquluzadə. *Bir gün qoca bağban xəstələnib öldü.* M.Hüseyn. // Qırılmaq, tələf olmaq, məhv olmaq (heyvanlar haqqında). *Qışda xeyli mal-qara öldü.* // Tələf olmaq, məhv olmaq (ağac, ot və s. haqqında). *Şaxtadan güllər öldü. – Çiçəyi soluxub, otu öləndə; Qaçardı üstündən quşu, heyvanı.* H.K.Sanılı.

2. *məc. dan.* Çox arzu etmək, can atmaq, çox istəmək, həsrətində olmaq. *Oxumaq üçün ölür.*

3. *məc.* Özündən qabaq gələn sözün ifadə etdiyi şeyin şiddətini, təsirini bildirir. *Sancıdan ölmək. Acından ölmək. Gülməkdən ölmək.*

4. **Mən ölüm** şəklində *dan.* – bir şeyi təkidli xahiş məqamında işlənir. *Mən ölüm, tez gəl. Mən ölüm, bu işə qarışma.* // **Sən öl, sən öləsən, siz öləsiniz** şəklində *dan.* – bir şeyə inandırmaq üçün işlənir: canın (canınız) üçün. [Məşədi İbad:] *A kişi, sən öl, mən sənə; Nə qədər desən pul verərəm.* Ü.Hacıbəyov. [Ata:]

*Siz öləsiniz, Arazda da heç belə nərilti olmazdı*. S.Rəhimov. // ...**ölsün** – and içmək, inandırmaq məqamında işlənir. [Hacı Qara:] *Oğlum ölsün ki, dəxi kisədə tənbəki yoxdur*. M.F.Axundzadə. [Səfi:] *Bu canım ölsün ki, bularda bir kələk var, gedim görüm nə danışırlar*. Ü.Hacıbəyov.

**ölə-ölə** *zərf* Güc-bəla ilə, zorla, çətinliklə, əziyyətlə. [Qurban:] *Hər gün ölə-ölə gəl, ölə-ölə qayıt, belin olsun yağır*. Ə.Haqverdiyev. *Bu tövr ilə Fərhad ölə-ölə məktəbi tamam etdi*. C.Cabbarlı.

**ÖLMƏLİ** *sif. dan.* Ölməsi lazım olan; yaşamağa layiq olmayan, cəmiyyət üçün heç bir faydası olmayan. *Mən hamayıl deyiləm; Ağlı zayıl deyiləm; Qoy ölsün ölməlilər; Sənə qayil deyiləm*. (Bayatı). [Birisi:] *Allah* [Hacı Aslana] *rəhmət eləsin, ölməli kişi deyildi.* S.Hüseyn.

**ÖLMƏZ** *sif.* 1. Həmişə yaşayan, heç bir vaxt ölməyən, yox olmayan; əbədi, həmişəlik. *Xalq ölməzdir*. – [Rizvan:] *Ürəyimdə ölməz bir məhəbbət ilə ölümə gedirəm*. Ə.Haqverdiyev. [Şiraslan düşünürdü:] *Ölməz bir dastan yazmaq da qəhrəmanlıq kimi bir hünərdir*. S.Rəhimov.

2. *məc.* Hər hansı bir məziyyətinə görə xalqın xatirəsindən silinməyən, unudulmayan; unudulmaz. *Ölməz sənətkar. Ölməz ad qoyub getmək. – Səndəki gözəllik ölməz sənətdir; İnsanlar sənətə gəlir səcdəyə*. N.Rəfibəyli.

**ÖLMƏZLİK** *is.* Heç bir zaman ölməyib yaşama; ölümsüzlük, əbədilik. *..Xalqımız ölməzliyini böyük mübarizələrdə təcrübədən keçirdi*. M.S.Ordubadi. *Əbədiyyət və ölməzlik xalqdadır və xalqdandır*. M.İbrahimov.

**ÖLMÜŞ** *f.sif.* 1. Həyatı tərk etmiş, vəfat etmiş, keçinmiş. *Bu səslər kimin isə, ölmüş bir adamın minacatını çəkirdi*. Mir Cəlal. // *İs. mənasında* (adətən cəm şəklində). Ölü. *Ölmüşlər və dirilər. – Belə ölmüşlərə fəda dirimiz.* S.Ə.Şirvani. *Könül var ki, vulkan kimi alov saçar hər yana; Həq söyləyən ilhamları ölmüşlərə can verər...* H.Cavid.

2. Nəvazişlə məzəmmət məqamında işlənir. [Bəy:] *Ay ölmüş, nökər olanda nə olar, dedik bir söz danış, söz olsun.* Mir Cəlal. // Eyni mənada körpə uşaq və ya heyvan haqqında. [Nərgiz] *toppuşu göstərib tövşüyə-tövşüyə dedi: – Ölmüş gör necə qəşəngdir, ana!* Ə.Məmmədxanlı.

**ÖLÜ** 1. *sif.* Ölmüş, həyatı tərk etmiş, cansız (*diri* ziddi). // *is.* Ölmüş adam, meyit, cənazə. *Ölülər və dirilər. Ölünü yarmaq. Ölünü basdırmaq.* – [Nazlı:] *Ana, deyirlər bu gələn qonağımız ölüləri diriltdir*. C.Məmmədquluzadə.

2. *sif.* Gəbərmiş, canı çıxmış (heyvan haqqında). *Ölü toyuq. Ölü pişik.* // *is.* Ölmüş heyvan cəsədi; cəmdək. *İt ölüsü. Qoyun ölüsü.*

3. *sif.* Qurumuş, solmuş, solğun, cansız (bitki haqqında). *Ölü ağac. Ölü ot.*

4. *sif.* Cansız, həyat əlamətindən məhrum. *Ölü çöl. Ölü şəhər*.

5. *is. məc.* Heç bir şeyə qabil olmayan, bacarıqsız, atil adam haqqında. *Ölünün biridir.*

6. *sif. məc.* Durğun, ətalətli, fəaliyyətsiz, təsirsiz, çox zəif, cansız. *..Həmin bu zamanda Qafqaz türklərinin mətbuatı ölü, bəlkə yox bir halda idi.* C.Məmmədquluzadə.

◊ **Ölü dil** – mövcud olmayan, lakin ancaq yazılı abidələrdən məlum olan qədim dil. *Çiçəklərin; Böcəklərin; Küləklərin; Fələklərin; Adlarını yazır alim; Ölü dildə.* B.Vahabzadə. **Ölü düşmək** – yorğunluq və s. nəticəsində hərəkətdən qalmaq, hərəkət edə bilməmək. *Yorğunluqdan ölü düşmək. – Almazı o qədər vurdular ki, ölü düşdü*. S.Rəhimov. **Ölü rəngi** – meyit rəngi, rəngi qaçmış, qanı qaçmış, saralmış. [Yasəmən və Qaraca qız] *bihuş qalıb yerə sərilmişdilər, üzlərinin rəngi ölü rəngi kimi idi.* S.S.Axundov. *Qocanın sifəti ölü rənginə çalırdı*. M.Hüseyn. **Ölünü (yerdən) götürmək** – ölünü dəfn etmək üçün qaldırıb aparmaq. *Ölünü saat beşdə yerdən götürəcəklər*. **Ölü yesə dirilər** – çox dadlı, cana xeyirli şey haqqında. *Kababxanaya gələn müştərilər birdən duyuq düşdülər ki, a kişilər, bu Namaz elə piti bişirir, yeməknən doymaq olmur.. Namazın qoyduğu pitini ölü yesə dirilər.* İ.Məlikzadə. **Ölü nöqtədə** – eyni vəziyyətdə, hərəkətsiz.

**ÖLÜB-DİRİLMƏ** "Ölüb-dirilmək"dən *f.is.*

**ÖLÜB-DİRİLMƏK** *f.* Bir işi görüncə çox əziyyət çəkmək, həddən artıq əzab və mə-

şəqqət çəkməli olmaq, yaxud təhlükə keçirmək.

**ÖLÜB-İTƏN** *sif.* və *is.* Ölən, məhv olan, aradan çıxan, sıradan çıxan. *Hamısı sağ-salamatdır, ölüb-itən yoxdur. – Körpə quzuların, xırda beçənin; Yoxdur ki, son zaman ölüb-itəni?* H.K.Sanılı. [Dilən:] *Yox, – dedi, – gərək ölüb-itən olmasın.* Mir Cəlal.

**ÖLÜB-ÖLDÜRMƏ** "Ölüb-öldürmək"dən *f.is.*

**ÖLÜB-ÖLDÜRMƏK** *f.* Bir-birini öldürməyə qalxışmaq, bir-birini öldürmək, vuruşmaq, qanlıbıçağa çıxmaq. *Olmadılar razı onu bölməyə; Çıxdı iş axır ölüb-öldürməyə.* A.Səhhət. *Çox zaman bu dava ölüb-öldürməyə və ədavətə də çatardı.* H.Sarabski.

**ÖLÜXANA** *is.* Xəstəxanalarda və s.-də meyitlərin saxlandığı yer, bina; morq.

**ÖLÜKSÜNMƏ** "Ölüksünmək"dən *f.is.*

**ÖLÜKSÜNMƏK** bax **ölüşkəmək**.

**ÖLÜM** *is.* 1. *biol.* Orqanizmin həyat fəaliyyətinin həmişəlik dayanması və onun məhv olması, orqanizmdə və ya onun bir hissəsində maddələr mübadiləsinin dayanması, kəsilməsi. *Fizioloji ölüm. Hüceyrənin ölümü. Bitkinin ölümü.*

2. İnsan və ya heyvanın həyatının sona çatması; ömrün nəhayəti; vəfat, ölmə. *Naqafil ölüm. Vaxtsız ölüm. – Dünyada elə sular var ki, insanı ölümdən qurtarır..* C.Məmmədquluzadə. *Güllü özünə ölüm arzuladı.* Ə.Vəliyev. // Ölmə, ölmək vaxtı. *Kərimxan insanın oturub dəqiqələri saya-saya ölümü gözləməyindən dəhşətli bir şey olmadığını bilirdi.* M.İbrahimov. ◻ **Ölüm ayağında** – ölmək, ya öldürülmək üzrə olma; ölərkən, ya öldürülərkən; ölüm qarşısında. *Əbdülkərimi gətirib dar ağacının altında dayandırdılar. Heç bir baxan deməzdi ki, bu adam ölüm ayağındadır.* Ə.Haqverdiyev. // *məc.* Bir şeyin sonu, məhvi. *Kapitalizmin ölümü.*

3. Edam cəzası. *Ölümə məhkum etmək.*

4. *məc.* Məhv olmaq təhlükəsi, dəhşətli fəlakət. *Demək, biz şəhərimizi ölümdən qurtardıq.* M.Hüseyn.

◊ **Ölüm yuxusu** – çox bərk yuxu. *Çulğamışdı hər tərəfi dumanlıq; Aləm ölüm yuxusuna batmışdı.* A.Səhhət. **Ölüm rəngi** – bax **ölü rəngi** ("**ölü**"də). *Kişinin sifətindən ölüm rəngi çətin-çətin çəkilirdi.* B.Bayramov. **Ölüm sükutu** – son dərəcə sakitlik, tam sükut. *Həbsxananı bir neçə saniyə ölüm sükutu bürüdü.* H.Nəzərli. *Ortalığı ölüm sükutu qaplamışdı.* M.Hüseyn. **Ölümə vermək** – bada vermək, məhvinə səbəb olmaq, fəlakətə sürükləmək. *Ata oğlunu ölümə verməyəcəkdir.* S.Rəhimov. **Ölümü gözünün altına almaq** – ölə biləcəyini nəzərə alaraq qorxmamaq. **Nə ölümü var?** – nəyinə lazımdır? nə işi var? nəyinə gərək? [Ata:] *Onun bu vaxt şəhərdə nə ölümü var?* M.Hüseyn. *Bu vaxt* [qızın] *küçədə nə ölümü var idi?* H.Seyidbəyli.

**ÖLÜMCÜL** *sif.* 1. Ölümlə nəticələnə bilən, ya nəticələnən, ölümə səbəb olan. *Ölümcül yara.* – [Mirzə Cəmil:] [Qönçənin] *anası ölümcül naxoşdur, yanında qalıb keşiyini çəkir.* Ə.Vəliyev. // Can verməkdə olan, ölmək üzrə olan. [Ananın] *ürəyi Bakıda ölümcül halda qoyub gəldiyi Əjdərin .. yanında idi.* S.Rəhman.

2. *məc.* Son dərəcə yorulmuş, yarımcan, haldan düşmüş. *Ölümcül halda evə çatmaq.* – [Kazım] *qan-tər içində və ürək döyüntüsü ilə mənzilə çatar, ölümcül yorğun olsa da ata qulluq etməyə başlardı.* Mir Cəlal.

**ÖLÜMCÜLLÜK** *is.* Ölümcül vəziyyətdə olan adamın, ya heyvanın halı.

**ÖLÜM-DİRİM: ölüm-dirim məsələsi** – çox vacib, son dərəcə mühüm, təxirəsalınmaz məsələ. [Əsgər:] *Bizim millət bu hadisələrin ölüm-dirim məsələsi olduğunu anlamır.* M.S.Ordubadi. *Başmaq məsələsi* [molla] *üçün ölüm-dirim məsələsinə çevrilmişdi.* Mir Cəlal. **Ölüm-dirim döyüşü (vuruşu, savaşı, mübarizəsi** və s.**)** – ölməkdən, yox olmaqdan, məhv olmaqdan qurtarmaq üçün aparılan döyüş (vuruşma, savaş, mübarizə və s.). *Cəngavərlər sinələrini sipər edib ağ gün uğrunda ölüm-dirim döyüşlərinə atılırlar.* S.Rəhimov. *Elə bil iki böyük dəstə nərə çəkib bir-birilə ölüm-dirim vuruşuna girmişdi.* M.Hüseyn. *Böyük bir cəbhədə ölüm-dirim mübarizəsi getdikcə qızışır.* M.İbrahimov.

**ÖLÜM-İTİM** *is.* Ölüm, fani, yoxluq. [Hacı Murad:] *Dünya ölüm-itimdir..* S.S.Axundov.

*Badə qaldır, eşq adına içək gəl; Ömür gödək, dünya ölüm-itimdir*. R.Rza.

**ÖLÜMQABAĞI** *sif.* və *zərf* Ölümdən bir az əvvəl, ölməyinə az qalmış. *Ölümqabağı vəsiyyət.*

**ÖLÜMSÜZLÜK** bax **əbədiyyət**. *Bizdə, bilən bilir, bu səslər ən çox; Oyadır eşqini ölümsüzlüyün*. M.Müşfiq.

**ÖLÜM-ZÜLÜM** *zərf* Çox çətinliklə, gücbəla ilə. *Ölüm-zülüm işi qurtarmaq*. – [Yolçular] *ölüm-zülüm kəndin içindən çıxıb, gecə yarısı Usta şəyirdi dediyimiz yerə çatardılar.* H.Sarabski. *Ağazal ölüm-zülüm gəlib onuncu sinfə çıxmışdı*. Ə.Əbülhəsən.

**ÖLÜNCƏ** *zərf* 1. Çox bərk, çox şiddətli, amansızcasına. *Ölüncə döymək.* – [Pərviz xan:] *Doğrusunu de, yoxsa səni soyundurub bədəninə ölüncə çubuq vurduracağam.* Ə.Haqverdiyev.

2. Ölənə qədər. *Ölüncə gözləmək. – İyid odu namusunu atmasın; Dost ölüncə dosta yalan satmasın.* Aşıq Ələsgər. *Hər zaman söylənib atan deyərdi:* "*Arvad tayfasıyla yoxam ölüncə!*" M.Müşfiq.

3. *məc.* Hədsiz dərəcədə, hədd bilmədən. *Ölüncə yemək.*

**ÖLÜŞ** *is.* Ölüm. *Xəstə olsam, Əsli gəlməz üstümə; Qərib-qərib ölüşümə nə dersiz?* "Əsli və Kərəm".

**ÖLÜŞKƏMƏ** "Ölüşkəmək"dən *f.is.*

**ÖLÜŞKƏMƏK** *f.* Solmaq, saralmaq, solub-saralmaq, büzüşmək. *Kirpikləri birbirinə qarışıb, bütün vücudu ölüşkəmiş və əndamı quru alma kimi büzüşmüşdü.* M.S.Ordubadi.

**ÖLÜVAY** *sif.* Əlindən iş gəlməyən; atil, bacarıqsız, aciz, key. [Pərini indi Teyyibə] *ölüvay hesab eləyir, üstünə ayaq alırdı.* M.Hüseyn. // İs. mənasında. *Ölü-vayın biridir*. – [Heybət:] *Görürsən də, Xəlil dayı? Saatlılar məni ölüvayların cərgəsinə yazmışdılar.* M.Hüseyn.

**ÖLÜVAYLIQ** *is.* Ölüvay adamın halı; bacarıqsızlıq, acizlik, keylik, atillik.

**ÖLÜYUYAN** *is.* Müsəlmanlarda: meyit yumaqla məşğul olan adam; mürdəşir.

**ÖMÜR** *is.* [*ər.*] 1. İnsan, heyvan və ya bitkinin doğuluşundan ölümünə qədərki fizioloji vəziyyəti; həyat. *Ömürdür, biri az yaşayır, o biri çox yaşayır*. T.Ş.Simurq. *Hayıf ömür qısa, arzu genişdir; Kim bu qayğı ilə titrəməmişdir.* M.Müşfiq. □ **Ömür yoldaşı** – arvad, zövcə, həyat yoldaşı. *Ağlını başına vursun, görsün ki, tapdığı adam onunla ömür yoldaşı olacaqmı?* Mir Cəlal.

2. **Ömrümdə, ömründə** şəklində – heç bir zaman, heç vaxt, qətiyyən. *Ömründə gəlməyib doğru dilinə.* Q.Zakir. [Naşad] *ömründə bu qədər sərt və dikbaş bir qadın görməmişdi.* S.Hüseyn.

3. **Ömrüm-günüm** şəklində – nəvazişlə, mehribanlıqla müraciət. [Qadın Tahirə:] *Bəs mənim balamı niyə gətirmədin, ömrümgünüm?* M.Hüseyn.

◊ **Ömür (ömrü) bada getmək** – ömrün hədər keçdiyinə təəssüf bildirir. *Könül verdim hər bivəfa yadlara; Hayıf oldu, ömür getdi badlara.* M.V.Vidadi. **Ömür keçirmək (sürmək)** – yaxşı və rahat yaşamaq; ümumiyyətlə, yaşamaq, həyat sürmək. *Sür ömrünü, çək ləzzətini, can ələ düşməz*. Ə.Qəmküsar. *İkisi də əl-ələ verib, şad və xürrəm diriliyin geniş bağında ömür sürürdülər*. Çəmənzəminli. *Telli .. dörd il bundan əvvəl İslamın evinə gəlmiş, yalnız iki ilini bəxtiyar bir gəlin kimi ömür sürmüşdü.* S.Hüseyn. **Ömür vermək** – həyat vermək, can vermək, yaşatmaq. *Donbas bizə kömür verir; Ocaqlara ömür verir.* M.Müşfiq. **Ömür (ömrü) yarıdan keçmək** – ömrün keçməsinə təəssüf bildirir. *Baş ağardı, ömür keçdi yarıdan; Qurtarmadım hərgiz ahü zarıdan.* Q.Zakir. **Ömrü uzanmaq** – daha çox yaşamaq, ömrü uzun olmaq. *Bülbülün səsi kimi; Qaynayır incə səsin; Sanki ömrüm uzanır; Uzandıqca nəfəsin*. Ə.Cavad. **Ömrü vəfa etməmək** – az ömür sürüb arzusuna, ümidinə yetişməmək, istədiyini, gözlədiyini görməmək, nəsib olmamaq. **Ömrüm (ömrün, ömrü...) boyu (uzunu)** – 1) həmişə, daima, bütün həyatım (həyatın, həyatı) boyunca. *Ömrüm boyunca sənə minnətdaram. Ömrü boyunca işləyib*; 2) heç bir zaman, heç bir vaxt. *Ömrüm boyu unutmaram.* **Ömründə bir gün görməmək** – ömrü boyu əzab-əziyyət çəkmək, xoş gün görməmək. [Balaş:] *Yazıq nə hala düşmüş, necə də saralmış, solmuş,* [Sevil] *ömründə*

*bir gün görməmiş*(*dir*). C.Cabbarlı. **Ömrün (ömrünüz) uzun olsun!** – xeyir-dua, təşəkkür məqamında işlədilir. [Mirzə Səfər:] *Ağa, məsləhətiniz çox gözəldir, ömrünüz uzun olsun, siz həmişə mənim uşaqlarımın qeydinə qalıbsınız*. Ə.Haqverdiyev. **Ömrünü çürütmək** – uzun zaman vaxtını boş keçirmək. [Gəray bəy Cəlala:] *Oğul, mən bilirəm, sevdaya düşən; İnsanlar ömrünü çürüdür bəzən..* S.Vurğun. **Ömrünü sənə (sizə** və s.**) bağışladı** – öldü, canı çıxdı.

**ÖMÜRBİLLAH** *zərf* [*ər.*] 1. İndiyə qədər, heç bir vaxt. *Ömürbillah belə şey olmayıb*.

2. Bütün ömrü boyu; həmişə, həmişəlik, daimi. *Ömürbillah əl çəkmək. Ömürbillah incimək.*

**ÖMÜRLÜ** *sif.* Uzun ömür sürən, ya sürmüş. *Ömürlü adam.*

**ÖMÜRLÜK** *sif.* Ömrünün axırına qədər davam edən, qüvvədə olan; həmişəlik. *Ömürlük təqaüd. Ömürlük pasport. Ömürlük həbs cəzası. – Ömürlük yol yoldaşıdır; Doğrudan da bizə adət*. S.Vurğun. *Kosa .. özünü ömürlük kuryerlik vəzifəsindən azad olmuş sayırdı*. S.Rəhimov.

**ÖMÜRSÜZ** *sif.* Ömrü az olan, az yaşayan, ömrü uzun sürməyən. *Ömürsüz ömürdən çox asılıyam; Gərəkdir söz deyəm, söz yastılayam.* M.Araz.

**ÖMÜRSÜZLÜK** *is.* Ömrün az olması, az yaşama, az ömür sürmə.

**ÖN** 1. Bax **qabaq²** 3, 4 və 6-cı mənalarda. *Ön tərəf. Ön divar. Ön sıra*.

2. *is.* Üzə tərəf olan cəhət; qabaq. *Evin önü.* – [Zeynal] *çox mütərəddid idi, öz qapısının önündə durub fikirləşməyə başladı.* S.Hüseyn. □ **Göz önündə** – göz qabağında, göz qarşısında. *Cümlə maarif əhlinin haləti göz önündədir.* M.Ə.Sabir.

**ÖNCƏ** *zərf* 1. Qabaqca, əvvəlcə, birinci olaraq. *Öncə ona söz verdilər*. – [2-ci kor:] *Nə öncə öylə səadət, nə böylə zillət olaydı.* H.Cavid. // Qabaqda, irəlidə, öndə. *Öncə kim gedəcək?*

2. Vaxtında, qabaqcadan. *Tədbiri öncə görmək lazımdır*.

**ÖNCƏDƏN** *zərf* Qabaqcadan, irəlicədən, əvvəlcədən, öncə. [Sirat] *işin .. bitib-bitməyəcəyini öncədən bilmək istəyirdi.* Ə.Əbülhəsən.

**ÖNCÜL** *is.* və *sif.* 1. Qabaqcıl. ..*Qəhrəman istəyir balaca Sabir .. öncül adamlardan olsun*. S.Rəhimov. *Lakin Qüdrət heç şübhə etmirdi ki, Aslanov yoldaş onun adını daha geridə qalanlar sırasında deyil, öncüllər sırasında çəkəcək.* M.Hüseyn.

2. Başçı, öndə gedən, qabaqda gedən, başçılıq edən. *Öncülünü itirmiş durna dəstəsini andıran bu qız dəstəsinin səsi meşəyə düşür, ağacların arası ilə uzana-uzana gedirdi*. Ə.Vəliyev.

**ÖNCÜLLÜK** *is.* Qabaqcıllıq.

**ÖNÇÜ** *dan.* bax **öncül** 1-ci mənada. *Önçü qız.*

**ÖNÇÜLÜK** *dan.* bax **öncüllük**.

**ÖNDƏR** *is.* Rəhbər, başçı. *Mənim öz ulduzumu bağrına basmış hilalım; Dedi öndər:* "*Yönü bayraqdakı üç rəngdən alım*". B.Vahabzadə.

**ÖNƏM** *is.* Əhəmiyyət, diqqət, fayda, xeyir.

**ÖNLÜK** *is.* İş görəndə paltar çirklənməsin deyə üstdən taxılan geyim; döşlük. *Ballı .. göz yaşlarını önlüyünün ətəyi ilə qurudurdu.* A.Şaiq. // Balaca uşaqlar üçün müşəmbə və ya parçadan tikilən döşlük.

**ÖNLÜKLÜ** *sif.* Önlük geymiş, önlük taxmış; döşlüklü. *Önlüklü uşaq. – Biləklər çirməkli, döşlər önlüklü; Hamısı torbalı, hamısı yüklü.* S.Vurğun.

**ÖPDÜRMƏ** "Öpdürmək"dən *f.is.*

**ÖPDÜRMƏK** *icb.* Öpməyə məcbur etmək, təhrik etmək, ya icazə vermək.

**ÖPMƏ** "Öpmək"dən *f.is.*

**ÖPMƏK** *f.* 1. Sevgi, dostluq, sevinc əlaməti olaraq, yaxud görüşdükdə və ya ayrıldıqda dodaqlarını birinə və ya bir şeyə toxundurmaq; busə etmək, busə almaq. *Gözlərindən öpmək. – Səhər Sona çay vaxtı adət üzrə anasını öpdü.* N.Nərimanov. *Mehriban məhəbbətlə qarışıq bir həyəcanla Rəmziyyənin üzündən, dodaqlarından, gözlərindən öpməyə başladı.* S.Hüseyn. // Obrazlı təşbehlərdə. *Axar çaylar öpdü o gün; Atlıların ayağından.* S.Vurğun. *Məzarı öpdükcə hörmətlə rüzgar; Düşür çöhrəsinə ılıq damlalar.* M.Rahim.

2. *məc.* Toxunmaq, təmas etmək, dəymək. [Arslan bəy Maralın verdiyi çiçəyi alaraq:]

*..Əllərinizi öpmüş olan bu munis gülə ömrüm olduqca pərəstiş edəcəyəm.* H.Cavid.

**ÖPÜLMƏ** "Öpülmək"dən *f.is.*

**ÖPÜLMƏK** "Öpmək"dən *məch. Dan yeri söküləndə; Zülf üzə töküləndə; Şeh düşmüş gülə bənzər; Ağ üzdən öpüləndə.* (Bayatı).

**ÖPÜŞ** *is.* Öpmək işi, öpmək tərzi; öpmə, busə. *Mehriban məhəbbət qarışıq bir həyəcanla Rəmziyyəni öpüşləri ilə sanki yemək istəyirdi.* S.Hüseyn. *Görürəm, öpüşür qoşa ulduzlar; Ancaq xəsis olur öpüşə qızlar.* S.Vurğun. □ **Öpüş almaq** – öpmək, busə etmək. *Əzizinəm, al bundan; Yanaq bundan, xal bundan; Şeytan vəsvəsə verir; Dur bir öpüş al bundan.* (Bayatı). **Öpüş göndərmək** – əlini dodaqlarına aparıb, birinə tərəf işarə etməklə ona sevgi və qayğısını ifadə etmək. **Öpüş vermək** – öpülmək, busə edilmək. // Obrazlı təşbehlərdə. *Ay işığı, gözəlliyin, qızlığın; Çiçəklərlə öpüşündən yarandın.* Ə.Cavad. *Şəfəqlər sökərkən öpüşlərindən; Yaranmış ağ, incə yanağın sənin.* A.Şaiq.

**ÖPÜŞDÜRMƏ** "Öpüşdürmək"dən *f.is.*

**ÖPÜŞDÜRMƏK** *icb.* Məcburi və ya xahişlə bir-birini öpdürmək. *Küsülüləri öpüşdürüb barışdırmaq.*

**ÖPÜŞMƏ** "Öpüşmək"dən *f.is.*

**ÖPÜŞMƏK** *qarş.* Bir-birini öpmək. *Qadınlar anamla öpüşür, söyləşir, gülüşürdülər.* A.Şaiq. *Dodaq-dodaqda öpüşdükcə xeyli söz verdin; Nə oldu, üz çevirib qaçdın aqibət məndən..* H.Cavid. // Obrazlı təşbehlərdə. *Çayların ahəngi axır qanımda; Çiçəklər öpüşür hər dastanımda.* S.Vurğun.

**ÖRDƏK** *is. zool.* Əti yeyilən vəhşi, ya əhli uzun boğazlı iri su quşu.

**ÖRDƏKBURUN** *is. zool.* Sifəti ördək dimdiyi kimi enli, məməli heyvan (vətəni Avstraliya və Tasmaniyadır).

**ÖRƏN** *is.* Əkilməmiş sahə.

**ÖRKƏN** *is.* Minik heyvanlarının çulunu sarıyıb bərkitmək üçün başında doğanaq olan uzun ip; çatı. *Örkən nə qədər uzun olsa, yenə də doğanaqdan keçər.* (Ata. sözü).

◊ **Örkən altına gətirmək** – tabe etmək, ram etmək. [Yarməmməd:] *Hörmətli sədrimizi lap örkən altına gətirəcəksiniz.* M.İbrahimov. ...**örkəninin üstünə odun yığmaq olmaz** – etibarsız, inanıla bilməyən, bel bağlanılmaz adam haqqında. [Şahpəri Şahmara:] *Bu sədrə çox da bel bağlama, onun örkəninin üstünə odun yığmaq olmaz.* B.Bayramov.

**ÖRKƏNLİ** *sif.* Örkəni olan.

**ÖRNƏK** *is.* Nümunə, misal. [Elxan:] *Biz hələlik vətənin yüksək dağlarına çəkiləcək, orada bütün bəşəriyyət üçün örnək ola biləcək bir ölkə düzəldəcəyik.* C.Cabbarlı. *..Ziyalılarımız hər işdə əhaliyə örnək olduqları kimi, ailə quruluşunda, ailə həyatında da bir nümunə olmalıdır*(*lar*). A.Şaiq. // Timsal. *Qəlbim örnəyidir yanar bir dağın.* M.Müşfiq.

**ÖRNƏKLİK** *is.* Örnək, nümunə ola biləcək hər bir şey; nümunə.

**ÖRPƏK** *is.* 1. Qadınların başlarına saldıqları iri ipək və ya başqa parçadan örtük, iri baş yaylığı. *Şəhrəbanu xanım ərinin sağ böyründə çənəsini yaşmayıb, ağ örpək başında, həllaci, samit əyləşibdir.* M.F.Axundzadə. [Mina] *örpəyinin ucu ilə gözlərini sildi.* Ə.Əbülhəsən.

2. *məc.* Örtük mənasında. *Dağlarının başı qardır; Ağ örpəyin buludlardır.* S.Vurğun.

**ÖRPƏKLİ** *sif.* Başına örpək örtmüş, başında örpək olan. *Çəhrayı örpəkli bir gəlin ya da; Cavan bir qızsanmı, ey əlvan budaq?* M.Dilbazi.

**ÖRPƏKSİZ** *sif.* və *zərf* Örpəyi olmayan; başıaçıq.

**ÖRT-BASDIR: ört-basdır etmək (eləmək)** – gizlətmək, üstünü malalamaq. [Gənc:] *Öz tərəfdarlarının zəifliyini ört-basdır eləyən bir adam rəhbər ola bilərmi?* M.Hüseyn.

**ÖRTDÜRMƏ** "Örtdürmək"dən *f.is.*

**ÖRTDÜRMƏK** *icb.* Örtmək işi gördürmək, örtməyə məcbur etmək.

**ÖRTMƏ** "Örtmək"dən *f.is.*

**ÖRTMƏK** *f.* 1. Örtük salmaq, üzərinə bir şey salmaq. *Kəlağayı örtmək. – Bu vaxt eşikdən Qulamxan səslənir: – Durun, başınızı örtün.* M.S.Ordubadi. // Üzərinə bir şey çəkib görünməz etmək. *Qızın başında çadrası olardı, lakin üzünü örtməzdi.* R.Əfəndiyev. *Hüsnünü örtməsin nə pərdə, nə rəng!* S.Vurğun. // Qabağını kəsmək, görünməz etmək. *Bütün sahili duman örtmüşdür.*

2. Bağlamaq, qapamaq. *Qapağı örtmək.* – [Sona] *tez otağına gedib qapını örtdü.*

N.Nərimanov. *Sürəyya yavaşca pəncərəni örtüb, ayağının ucunda ehmallıqla qayıdıb yatacağına uzandı.* Çəmənzəminli.

3. Üstünə bir şey salmaq, sərmək. *Cərgə ilə düzülmüş yamyaşıl şam ağaclarını ağappaq qar örtmüşdü.* M.İbrahimov. // *məc.* Bürümək, sarmaq, çulğamaq, tutmaq, basmaq. *Mən çox istərdim ki, sənin hər zaman; Örtməsin o dilbər hüsnünü duman.* S.Vurğun. *Ancaq hərdən meşələri qalın duman bürüdüyü kimi Cavadın sifətini də kədər örtürdü.* Ə.Vəliyev.

**ÖRTÜ** *is.* 1. Başa örtülən hər hansı bir şey. *Başındakı örtünü götürmək.* – [Sevda] *başındakı ağ ipək örtünü bir yana atar.* H.Cavid. [Qətibə] *baş örtüsünün qarşısına almaz, yaqut və incilərdən düzəlmiş bir cıqqa taxmışdı.* M.S.Ordubadi.

2. Pərdə. *Sinəsini açar mana; Örtüsü ağ pəncərələr.* S.Vurğun. *Bu məxmər örtüyünün üzərinə də bir qədər ensiz ağ örtü çəkilmişdir.* S.Rəhimov. // Məc. mənada. *Üzündə qalmışdır qara ləkələr; Bir matəm örtüsü geyindi şəhər.* S.Vurğun.

**ÖRTÜB-BASDIRMA** "Örtüb-basdırmaq"-dan *f.is.*

**ÖRTÜB-BASDIRMAQ** *f.* Üstünü örtmək, üstünü malalamaq, gizlətmək. *Pis əməllərini örtüb-basdırmaq.*

**ÖRTÜCÜ** *sif.* Bir şeyi örtən, pərdələyən, bir şeyin üzərinə çəkilən, üstünü örtən. *Örtücü şüşə. Örtücü boya.*

**ÖRTÜK** *is.* 1. Hər hansı bir şeyin üzərinə çəkilən, salınan parça. *Xonça örtüyü. – Pərinin anası ilə Əşrəf baba içəri girib ölünün üstünə bir örtük çəkdilər.* Ə.Məmmədxanlı. *Mən bir də gözlərimi dolandırıb baxdım, gördüm ki, hələ neçə-neçə heykəl örtükdədir.* S.Rəhimov. // Çexol. [Qəhrəman yüzbaşı] *kamançanı götürür əlinə, başlayır örtüyünü açmağa.* C.Məmmədquluzadə. *İmi çəhrayı atlaz örtüyü açıb, başdan-başa sədəfə tutulmuş tarını ehtiyatla çıxartdı.* İ.Əfəndiyev.

2. Süfrə. *..Zəhra xala stol qoyub, üstünə qırmızı örtük salmışdı.* Mir Cəlal. // Yorğan, balış və s. üstünə salınan parça. *..Sərvnaz öz otağında ipək yorğanına örtük tikirmiş.* Ə.Vəliyev.

3. B a x **örtü**. [Şah Sitarəyə:] *Sənə hökm edirəm, kənar et örtüyü!* C.Cabbarlı. *Ağ örtüyə büründürür aləmi; Çulğalayır, geyindirir aləmi.* A.Səhhət.

4. *xüs.* Bir şeyi üstdən, üzdən örtən şey. *Bitki örtüyü. Torpaq örtüyü. Asfalt örtü* (yolun və s.-nin üzərinə döşənən asfalt qatı).

**ÖRTÜKLÜ** *sif.* Örtüyü olan, bir şeylə örtülmüş. *Bunların qarşısında azca kənar; Yaşıl örtüklü bir böyük miz var.* A.Səhhət. *Hər iki divar uzunu ağ parusin örtüklü stullar düzülmüşdü.* M.Hüseyn.

**ÖRTÜLMƏ** "Örtülmək"dən *f.is.*

**ÖRTÜLMƏK** *f.* 1. Qapanmaq, bağlanmaq. *Həyət qapısı örtüləndə sanki günəş də batdı. Tellinin sevinci yox olub getdi.* Çəmənzəminli. *..Küçə qapısı açıldı, sonra da bərk örtüldü.* Mir Cəlal.

2. Sarılmaq, qaplanmaq, çulğalanmaq. *Göy üzü qalın buludlarla örtülmüş, üfüqlər daralmışdı..* M.İbrahimov.

3. Dam tikilib üstü bir şeylə qapanmaq. *Evin damı örtüldü. – Qədimovun qırmızı kirəmitlə örtülmüş yeddiotaqlı, ikimərtəbəli evi Sabir adına onillik məktəbdən o qədər də uzaq deyildi.* Ə.Əbülhəsən.

**ÖRTÜLÜ** *sif.* 1. Üzərinə qapaq qoyulmuş, ya örtü salınmış. *Örtülü tabaqlarda pay-pay bölünmüş təzə qurbanlıq ət qonşulara paylanırdı.* Mir Cəlal.

2. Örtülmüş, qapanmış. *Örtülü qapı. Örtülü pəncərə.*

3. *məc.* Gizli. *Onunçun da mərhumun övladının xatirinə dəyməsin deyə onun adını burada örtülü* (z.) *qoyduq.* C.Məmmədquluzadə. // İkimənalı, qaranlıq, dumanlı. *Örtülü* (z.) *danışmaq. – Örtülü bazar dostluğu pozar.* (Məsəl).

4. *məc.* Həll olunmamış. *Məsələ örtülü* (z.) *qaldı.*

**ÖRTÜLÜLÜK** *is.* Örtülü olma, qapalı olma, açıq olmama.

**ÖRTÜLÜTOXUMLULAR** *cəm, bot.* Yumurtacıqları toxumluqla örtülü olan bitki dəstəsinin adı.

**ÖRTÜNCƏK** *is.* Örtünməyə yarayan hər bir şey; bürüncək.

**ÖRTÜNCƏKLİ** *sif.* Örtüncəyi, bürüncəyi olan; bürüncəkli.

**ÖRTÜNMƏ** “Örtünmək”dən *f.is.*

**ÖRTÜNMƏK** *qayıd.* Öz üzünü, yaxud üstünü bir şeylə örtmək.

**ÖRÜŞ** *is.* Mal-qara otarılan yer, geniş otlaq. *Sürünü örüşə buraxmaq. – Bu zaman Nəbi örüşdə qoyun otarırdı.* “Qaçaq Nəbi”. *Səltənət camışı örüşə ötürüb qayıdırdı.* B.Bayramov.

**ÖSKÜRƏK** *is.* Adətən nəfəs yollarının xəstələnməsi və ya qıcıqlanması ilə əlaqədar olaraq qeyri-ixtiyari çıxarılan xırıltılı, xışıltılı səs; öskürtü. [O] *cavab vermək istədi, lakin vərəm öskürəyi danışmağa macal vermədi.* M.S.Ordubadi. *Bir-iki ağız quru öskürək qarının sözünü yarımçıq kəsdi..* Ə.Əbülhəsən. // Öskürmə xəstəliyi. *Kəndimizdə nə çirk, nə öskürək, nə də azar var.* S.Vurğun.

**ÖSKÜRƏKLİ** *sif.* Öskürəklə birlikdə olan.

**ÖSKÜRƏKOTU** *is. bot.* Gilli torpaqlarda, rütubətli dərələrdə, uçqunlarda və sahillərdə bitən çoxillik ot-bitki.

**ÖSKÜRMƏ** “Öskürmək”dən *f.is. Öskürmələr, asqırmalar, boğaz arıtmalar bir-birinə qarışdı.* M.S.Ordubadi. *Qaraltının öskürməsi Qüdrətəli üçün naməlumu aşkar etdi.* T.Ş.Simurq.

**ÖSKÜRTMƏ** “Öskürtmək”dən *f.is.*

**ÖSKÜRTMƏK** *icb.* Öskürəyə səbəb olmaq, öskürək gətirmək. [Daşdəmir:] *Başqa tütün çəkəndə məni öskürdür.* M.Rzaquluzadə.

**ÖSKÜRTÜ** b a x **öskürək**. *Öskürtü səsi. – Hava sakit, kənd səssiz olanda qonaqların öskürtüsü eşidilir.* Ə.Vəliyev.

**ÖSKÜRÜŞMƏ** “Öskürüşmək”dən *f.is. Kolxoz tövlələrinin qabağında .. qoyun və keçilərin öskürüşməsi davam edirdi.* Ə.Vəliyev.

**ÖSKÜRÜŞMƏK** *qarş.* Birdən, bir-birinin dalınca öskürmək (çoxları haqqında). *Qoyunlar gövşəyir, keçilər öskürüşür, itlər hürüşür, çobanlar səs eləyib bir-birinin yatmasına mane olurdular.* Ə.Vəliyev.

**ÖTƏ[1]** *əvəz.* 1. Danışana görə əsas götürülən bir şeydən daha uzaq olan yeri, tərəfi bildirir (*bəri* müqabili). *Ötədə oturmaq. Ötədən keçmək.*

2. Bir şeyin dal tərəfi, dalı, arxası. *Dağın ötə tərəfində. Stolun ötəsinə keçmək.*

3. Sonrakı, ardı, dalı. *Ötəsindən xəbərim yoxdur.*

**ÖTƏ[2]** *sif.* Üstün, artıq, ötkün. *Hazırcavablıqda bacı qardaşından ötədir. – İlyas Əsmər xalanın ərininkindən də ötə olan deyintilərinə dözə bilərdi.* İ.Hüseynov.

**ÖTƏ-BƏRİ** *əvəz.* Müxtəlif yerlər; ora-bura, o tərəf-bu tərəf. [Xəlil] *xırda otağında bir-iki dəfə ötəyə-bəriyə gedib, sinirlərini yatırmaq üçün yazı masasına oturdu.* Çəmənzəminli. [Molla Xəlil] *..qapının ötəsini-bərisini yoxlamağa başladı.* S.Hüseyn. ☐ **Ötədə-bəridə** – orada-burada, addabudda. **Ötədən-bəridən** – oradan-buradan. [Telli] *bir saata qədər müəllimlə ötədən-bəridən söhbət edirdi.* S.Hüseyn. *İki quda ötədən-bəridən məhəbbətlə danışdılar.* A.Şaiq.

**ÖTƏDƏKİ** *sif.* O yandakı, o tərəfdəki. *Bu aralıq fürsətdən istifadə edən Dövlət bəy və tapançası düşmüş Qurban ötədəki otağa atılıb içəridən qapını bağlayırlar.* C.Cabbarlı.

**ÖTƏKİ** *sif.* O biri, digər, başqa. *Bu kitabı yox, ötəki kitabı verin. Ötəki otaq bundan daha genişdir.*

**ÖTƏN** *sif.* 1. Keçən, bundan əvvəlki, keçmiş. *Ötən gün bizə gəlmişdi.*

2. **Ötənlərdə** şəklində *zərf* – keçmişlərdə, keçmiş zamanda, keçmiş günlərdə, əvvəllərdə.

**ÖTƏRGİ** b a x **ötəri[1]**. *Bəzən də ötərgi bir həyat qəmi; Ürəkdə böyüyüb bir dastan olur.* S.Vurğun. [Oğlan] *ötərgi Mustafanın kefini soruşdu.* Mir Cəlal. *..Faytonçu bu mənzərəyə ötərgi baxıb atları qamçıladı.* M.Hüseyn.

**ÖTƏRİ[1]** *sif.* və *zərf* 1. Gözucu, tez, ani. *Ötəri baxmaq. – Sərnişin qızın gizləndiyi kabinəyə ötəri nəzər salıb, aşağı endi.* Q.İlkin.

2. *məc.* Səthi, dilucu, sözarası, könülsüz. *Ötəri cavab.* – [Yusif] *Şahpərini Sərvnaz qarıgilin həyət qapısında görüb ötəri salam verdi.* B.Bayramov.

3. Müvəqqəti, keçici. *Ələmdar elə bilirdi ki, Zərrintac xanımın gündüzkü qışqırtısı ötəri bir hal, bəy xanımlarına məxsus bir işvənazdır.* S.Rəhimov.

**ÖTƏRİ[2]** *dan.* b a x **ötrü**. *Bir söyüşdən ötəri etmə əziyyət balama.* M.Ə.Sabir. [Mehdi:] *Xalqı incidirlər bizdən ötəri; Hünər meydanıdır igidin yeri.* S.Rüstəm.

**ÖTKƏM** *sif.* və *zərf* Dilli-dilavər, lovğa, dikbaş, təkəbbürlü. *Ötkəm adam. – Biz görən deyil Abdulla paşa; Cürət bahəm edib, ötkəm olubdur.* Q.Zakir. [Arazın] *belə kəsərli və ötkəm sözləri podratçının xoşuna gəldi.* A.Şaiq.

**ötkəm-ötkəm** *zərf* Lovğa-lovğa, dikbaşcasına. *Ötkəm-ötkəm danışmaq.*

**ÖTKƏMLİK** *is.* Lovğalıq, dikbaşlıq, təkəbbürlük.

**ÖTKÜN** *sif.* 1. Ötmüş, həddindən artıq yetişmiş (meyvə, taxıl haqqında). // Həddindən artıq bişmiş, vaxtından artıq od üstündə qalıb keyfiyyətini itirmiş (bişmiş haqqında).

2. Üstün. [Əlioğlu:] *Hava açılır, bəlkə sən də getdin. Yenə ağıl ağıldan ötkün olar.* S.Rəhimov.

3. *məc.* Ötən, keçən, təsirli. *Ötkün sözüm, kəskin bəxtim olaydı; Ağ otağım, zərrin rəxtim olaydı.* Aşıq Ələsgər.

4. *məc.* Məlahətli, zərif, ahəngdar, lətif. *Qızın ötkün səsində xəfif bir titrəyiş vardı.* M.Hüseyn.

5. *məc.* Qüvvətli, təsirli.

**ÖTKÜNLÜK** *is.* Ötkün şeyin halı, keyfiyyəti.

**ÖTMƏ¹** "Ötmək¹"dən *f.is.*

**ÖTMƏ²** "Ötmək²"dən *f.is.*

**ÖTMƏK¹** *f.* 1. Keçmək, keçib getmək, gəlib keçmək. *Yoldan ötmək.* – [Əsirlər] *Aslanın, Uğurun və bir neçə partizanın köməyi ilə meşəni ötüb dağlara yetişdilər.* S.Vəliyev. // Bir yerin, sahənin ortasından, içindən keçmək, keçib getmək. *Kənddən ötmək.* [Seymur] *..küçəni ötüb, dar dalanlarla evlərinə sarı tələsirdi..* H.Seyidbəyli. // Uçub getmək, uçaraq keçmək. *Bir dəstə quş çayı ötdü. – Hərdənbir kəndin üzərindən .. durna dəstələri ötüb keçirdi.* Ə.Məmmədxanlı.

2. Hərəkətdə, yerişdə, qaçışda qabaqlamaq, irəli getmək, ötüb keçmək, geridə buraxmaq. *Velosipedçini ötmək. Yük maşınını ötmək.* // İrəlidə olmaq, keçmək. *Yarışda ötmək. – Bəli, gərək Qəhrəman ötsün də! – deyə Rüstəm yenə də qəti cavab verdi.* S.Rəhimov. // *məc.* Bir şeydə o birilərinə görə daha çox müvəffəq olmaq, daha çox nailiyyət əldə etmək. *Dərsdə yoldaşlarını ötmək. Region dövlətlərini ötmək.*

3. Keçmək, aşmaq, atlamaq, sovuşmaq, qurtarmaq (saat, mövsüm, zaman, yaş haqqında). *Saat ikini ötdü. Yaşı əllini ötüb. İsti günlər ötdü. – Qış da yavaş-yavaş qarı və soyuğu ilə ötüb getdi.* Çəmənzəminli. *Ötdü yaz, soldu çiçək, inlədi bülbül, kələbək.* M.Müşfiq.

**ÖTMƏK²** *f.* Oxumaq, cəh-cəh vurmaq, civildəşmək. *Səhər açıldı, quşlar ötdü.* Ə.Vəliyev. // *məc.* Tərənnüm etmək. *Yaşıl yamacda qumru tək; Ötür yanıqlı bir tütək.* Ə.Cəmil.

**ÖTMÜŞ** *f.sif.* 1. Ötüb-keçmiş, keçib-getmiş. *Ötmüş günlər* (*hadisələr*).

2. Aşmış, keçmiş, addamış. *Üçüncü adam yaşı qırxı ötmüş bir kişi idi.* Ə.Əbülhəsən. *Ağayar ucaboylu, sifətcə çox yapışıqlı, yaşı təzəcə qırxı ötmüş qarınlı bir kişi idi..* Ə.Əbülhəsən.

**ÖTRÜ** 1. *qoş.* Çıxışlıq halda olan sözlərdən sonra gələrək səbəb, ya məqsəd bildirir. *Pəs rəfiqlərimi intizarçılıqdan çıxarmaqdan ötrü genə gərək bir neçə söz ərz edəm.* C.Məmmədquluzadə. [Sevər] *Qızları da göndərərəm ki, çöldən sənin üçün tac qayırmaqdan ötrü çiçək dərsinlər..* C.Cabbarlı.

2. Mürəkkəb qoşmanın ikinci tərkib hissəsi kimi işlədilərək, özündən əvvəlki fikrin sonrakı fikrə səbəb olduğunu bildirir. [Oğlan:] *Nə olacaq, ondan ötrü niyə üzülürsən?* Mir Cəlal.

**ÖTÜB-KEÇMƏ** "Ötüb-keçmək"dən *f.is.*

**ÖTÜB-KEÇMƏK** b a x **ötmək¹** 1-ci mənada. *Bu çinarın dövrəsi yay fəslində buradan ötüb-keçən arabaçıların .. düşərgə yeri olmuşdu.* S.Rəhimov.

**ÖTÜRHAÖTÜR** b a x **ötür-ötür**. [İsi dayı:] *Bilmirəm ötürhaötür nə vaxt qurtaracaq.* B.Bayramov.

**ÖTÜRMƏ** "Ötürmək"dən *f.is.*

**ÖTÜRMƏK** *f.* 1. Yola salmaq. [Əli:] [Koxa] *yola düşəndə heç kim onu ötürməyə çıxmasın.* N.Nərimanov. *Qalxıb getdikdə* [Ceyranı] *ötürmək məqsədi ilə dışarı çıxır.* S.Hüseyn.

2. Bir-birinə verərək göndərmək. *Yazını qabaqdakına ötürmək.*

3. Bir şeyi tez, xəlvəti, başqalarına sezdirmədən qoymaq, salmaq, vermək. [Oğlan]

*qarşı tərəfdən beş nəfər silahlı adamın gəldiyini görür və bombanı cibinə ötürür..* M.S.Ordubadi.

4. Üstündən keçmək, buraxmaq, fikir verməmək, nəzərdən qaçırmaq. *Oxuyarkən iki sətir ötürmək.* – [Dərviş:] *Bir neçə məqamı mən özüm qəsd ilə ötürdüm.* A.Divanbəyoğlu. *Məclisdəkilər Qənbərovu böyük maraq və diqqətlə dinləyir, onun bir kəlməsini belə ötürmürdülər.* Ə.Vəliyev.

5. *məc.* Acgözlüklə, tez-tez yemək; aşırmaq. *Kazım halvadan iri tikələr tutub ötürdükcə gözlərinə işıq gəlirdi.* Çəmənzəminli. *Sübhanverdizadə kababdan ötürərək birinci butulkanı boşaltdı.* S.Rəhimov.

6. Gəlməmək, iştirak etməmək, buraxmaq. *Dərsi ötürmək.*

7. Qaçırmaq, əldən çıxarmaq, istifadə edə bilməmək, çata bilməmək. *Trolleybusu ötürmək. Fürsəti ötürmək.*

◊ **İçəri ötürmək** – b a x **içəri**. **Köksünü ötürmək** – b a x **köks**.

**ötür-ötür** *zərf* Bir-birinə ötürmə.

◊ **Ötür-ötürə salmaq** – bir-birinə ötürmək, bir-birinin üstünə atmaq, qəsdən ləngitmək, bu gün-sabaha salmaq. *İşi ötür-ötürə salmaq.*

**ÖTÜRÜCÜ** *is.* 1. Ötürən, yola salan, müşayiət edən, yanınca gedən.

2. *tex.* Hərəkəti və s.-ni maşının bir hissəsindən o birinə nəql edən qayış, dişli çarx və s. *Hərəkət ötürücüsü.* // Sif. mənasında. *Ötürücü qayış. Ötürücü çarx.*

**ÖTÜRÜLMƏ** "Ötürülmək"dən *f.is.*

**ÖTÜRÜLMƏK** "Ötürmək"dən *məch. Ön cəbhədən bizə tərəf ötürülən* (f.sif.) *əsirlərin sayı yox idi.* Mir Cəlal.

**ÖTÜRÜM** *is.* Udum. *..Pendir-çörəyi iki ötürümdə yedi.* S.Rəhman.

**ÖTÜŞ** *is.* Ötüşmə, qaçışma, yüyürüşmə. *Qaç oğlan! Qaç! At basdı! Millət gəlir! Ötüşdən çıxan bir camaat gəlir.* M.Ə.Sabir.

**ÖTÜŞDÜRMƏ** "Ötüşdürmək"dən *f.is.*

**ÖTÜŞDÜRMƏK** 1. *icb.* Ötüşməyə sövq etmək, ötüşməkdə bir-biri ilə yarışdırmaq. *Uşaqları ötüşdürmək.*

2. *f.* Ötürmək, sovuşdurmaq, başdan eləmək. *Hərifi xoş dillə ötüşdür getsin.*

**ÖTÜŞMƏ¹** "Ötüşmək¹"dən *f.is.*

**ÖTÜŞMƏ²** "Ötüşmək²"dən *f.is. Turacların, bildirçinlərin ötüşmələri ən xoş bir musiqi təsiri ilə insanı heyran edirdi.* M.Rzaquluzadə.

**ÖTÜŞMƏK¹** *qarş.* 1. Ötüb keçmək (çoxları haqqında). *Oradan sürətlə ötüşdük.* M.S.Ordubadi. [Ovçular] *da mümkün qədər səs-küysüz ötüşməyə çalışırlar.* M.Rzaquluzadə.

2. Gəlib-keçmək, ötmək. *Ötüşdü aylar, illər, evləndik o da, mən də; Ayağımız kəsildi bir-birinin evindən.* S.Rüstəm. // Keçib-getmək, uzaqlaşmaq. *Buralardan yüyür, tez ötüş barı; İlxının kişnəyir ayğır atları.* A.Səhhət.

3. Yüyürməkdə, qaçışda yarışmaq, bir-birini ötməyə çalışmaq. *Yığıb çantalara yerdən-yemişdən; Yolda gah yüyürüb, gah ötüşərdik.* S.Vurğun.

4. Birtəhər yaşamaq, güzəran keçirmək, keçinmək, dolanmaq. *Çətinliklə ötüşmək.* – *Ailə isə pendir, çörək və bu kimi şeylərlə ötüşürdü.* M.S.Ordubadi.

**ÖTÜŞMƏK²** *qarş.* Səs-səsə verərək oxumaq, cəh-cəh vurmaq, tərənnüm etmək. [Ağcaqız:] *Şahsənəm, gəl çıxaq bağa, bülbüllər elə ötüşür ki, gəl görəsən.* "Aşıq Qərib". *..Quşlar həzin-həzin ötüşürdülər..* S.Vəliyev.

**ÖVC** *is.* [*ər.*] *klas.* Ən uca nöqtə. ☐ **Övci-fəza, övci-fələk** – göyün, fəzanın ən yüksək nöqtəsi. *Övci-fəzadə görərək bayquşu; Səhnədə çaqqıllayıram imdi mən.* M.Ə.Sabir. **Övc atmaq** – boy atmaq, böyümək. *Yoxsa daha niyə burada böyürtkənlər belə suvarılmış kimi övc atsınlar.* S.Rəhimov. **Övc etmək (eləmək)** – artmaq, böyümək, inkişaf etmək. [Səməd bəy] *bir ildən sonra imtahan verdi, kənd müəllimi oldu, burada da artıq övc eləyə bilmədi.* Çəmənzəminli. *İndi arı yaman övc eləyir.* S.Rəhimov.

**ÖVKƏLƏMƏ** "Övkələmək"dən *f.is.*

**ÖVKƏLƏMƏK** *f.* Əli ilə əzişdirmək. [Şərəfnisə xanım] *şəkil kağızlarını dişindişinə qısıb əlində bərk-bərk övkələyir, salır ayağı altına.* M.F.Axundzadə. *..Qapı açıldı, əlində şapkasını övkələyən usta Ramazan hirsli addımlarla içəri girdi.* M.Hüseyn. // Ovuşdurmaq, ovmaq, masaj etmək. *Boynunu övkələmək. Qolunu övkələmək.*

**ÖVKƏLƏNMƏ** "Övkələnmək"dən *f.is.*

**ÖVKƏLƏNMƏK** "Övkələmək"dən *məch.*

**ÖVKƏLƏTMƏ** "Övkələtmək"dən *f.is.*

**ÖVKƏLƏTMƏK** *icb.* Ovuşdurtmaq, ovdurmaq. *Kürəyini övkələtmək.*

**ÖVKƏMƏ** "Övkəmək"dən *f.is.*

**ÖVKƏMƏK** b a x **övkələmək**.

**ÖVKƏŞİK** *sif.* Övkələnmiş, əzilmiş. *Övkəşik köynək.*

**ÖVLAD** *is.* [*ər.* "vələd" söz. cəmi] 1. Oğul və ya qız; uşaq, oğul-uşaq. [Dərviş:] *Bu binəvaların övlad sarıdan tək bir qızları var idi.* A.Divanbəyoğlu. [Bəhram:] *Ana öz övladının fikrini hamıdan artıq çəkir*. C.Cabbarlı.

2. Nəsil, soy, zürriyyət. *Qəhrəmandır onun azad övladı; Qafqazda məşhurdur onların adı*. A.Səhhət.

**ÖVLADCANLI** *sif.* Öz övladını, oğul-uşağını çox istəyən; uşaqcanlı. *Övladcanlı kişi*.

**ÖVLADLI** *sif.* Övladı olan, oğlu-qızı olan, oğul-uşaqlı. *Övladlı ailə.*

**ÖVLADLIQ** *is.* 1. Övladın ata-anaya qohumluq münasibəti.

2. Övladın ata-ana qarşısındakı vəzifəsi. *Övladlıq borcu*.

3. Övladı olmayanların övlad kimi (rəsmi, ya qeyri-rəsmi) öz ailələrinə qəbul etdikləri uşaq.

**ÖVLADSIZ** *sif.* Övladı, uşağı olmayan; oğul-uşaqsız, sonsuz. *Övladsız ailə.*

**ÖVLADSIZLIQ** *is.* Övladın olmadığı hal; oğul-uşaqsızlıq, uşağı olmama, sonsuzluq. *Bu arvadın dünyada övladsızlıqdan başqa bir qəm-qüssəsi yox idi.* S.S.Axundov.

**ÖVLİYA** *is.* [*ər.* "vəli" söz. cəmi] Həyatını Allah yolunda sərf edərək ona yaxınlaşmağa nail olmuş müqəddəs şəxslər. // *məc*. Müqəddəs, təmiz, saf, pak (həlim və gözəl əxlaqa malik adam haqqında). [Xumar Şeyx Sənan haqqında:] *Hələ dursun kamalı, mərifəti; Onda var sanki övliya sifəti*. H.Cavid. [Qızlar:] *Ay Sayalı xala, sənin üzündə övliya nuru var*. Mir Cəlal.

**ÖVRAQ** *is.* [*ər.* "vərəq" söz. cəmi] *klas.* Kağız vərəqləri; yazılar. *Yığ övraqın, qələmdanın; Həlakətdən qutar canın.* Ə.Nəzmi.

**ÖVRƏ** *is.* Bəzi adamlarda: bir para şeyləri yedikdə bədənlərində əmələ gələn səpki, qızartı.

**ÖVRƏT** *is.* [*ər.*] *köhn.* 1. Arvad, zövcə, həyat yoldaşı. *Sağ tərəfdən hacının övrəti əyləşib əlində dəsmal*. Ə.Haqverdiyev. [Hacı:] *Bir övrət, bir qızım, iki cavan oğlum, özüm xoşbəxt!* C.Cabbarlı.

2. Qadın (ümumiyyətlə). *Müsəlman övrətinin özgə kişiyə üzüaçıq görsənməyi xilafişərdir..* C.Məmmədquluzadə. *Zalda çox adam var idi: övrət, uşaq, kişi..* Ə.Haqverdiyev.

**ÖVRƏTBAZ** [*ər.* övrət və *fars.* ...baz] *köhn.* Arvadbaz.

**ÖVRƏTBAZLIQ** *köhn.* Arvadbazlıq. *..Mənim belə yadıma gəlir ki,* [türk padşahlarının] *arzu və məşğələləri övrətbazlıq idi.* C.Məmmədquluzadə.

**ÖVRƏTLİK** *köhn. is.* 1. Arvadlıq. [Nəbi:] *Mənim qızım da sənin evində beş il-altı il övrətlik eləyib*. Ə.Haqverdiyev.

2. B a x **qadınlıq** 1-ci mənada.

**ÖVSAF** *is.* [*ər.* "vəsf" söz. cəmi] *klas.* 1. B a x **vəsf**. *Müştəridir sənə Zöhrə fələkdə; Gecə-gündüz övsafını deməkdə*. Q.Zakir.

2. Səciyyəvi xüsusiyyətlər, bir şəxsin necəliyini göstərən sifətləri. *Qasımbəy Qarabağ əhlinin övsaf və əxlaqını nəzmə çəkibdir.* F.Köçərli.

**ÖVZA** *is.* [*ər.* "vəz" söz. cəmi] *klas.* b a x **vəziyyət**. *Xalqın övzaına xəbərdar ol.* S.Ə.Şirvani. *Bədirlənmiş ay qalxıb, göyün bir qatında durub, bu övzaya tamaşa edirdi.* Ə.Haqverdiyev.

**ÖYƏC** b a x **ögəc**.

**ÖYLƏ**[1] *is. köhn.* Günorta.

**ÖYLƏ**[2] *köhn.* b a x **elə**.

**ÖYMƏ** "Öymək"dən *f.is.*

**ÖYMƏK** *f.* Tərifləmək. *Başladı tərifə palıd qamətin; Öydü özün, zorbalığın, halətin*. M.Ə.Sabir.

**ÖYNƏ** *is. məh.* 1. B a x **növbə**. *Barmaqla nişan verib səni; Budur, – deyirlər; – Neçə dəzgah; Dalında bir öynədə çalışan.* R.Rza.

2. Dəfə, kərə. *İşə buyurarsan, naxoşam deyər; Öynədə bir badya doğrama yeyər..* Aşıq Ələsgər. [Zeynal:] *Kişi bu uzunqulağa gündə üç öynə arpa verirmiş, bir gün olur ki, kişi arpanın bir öynəsini yaddan çıxardır.* Ə.Əbülhəsən.

**ÖYNƏLİK** *is. məh*. Dəfəlik, kərəlik. *Bu dərman beş öynəlikdir*.

**ÖYRƏDİCİ** *sif.* Öyrətmək məqsədini daşıyan, öyrədən, bilik verən. *Yoxlama imla eyni zamanda öyrədici rola da malikdir. – Məhsuldar əmək öyrədici əməkdir*. (Qəzetlərdən).

**ÖYRƏDİLMƏ** "Öyrədilmək"dən *f.is.*

**ÖYRƏDİLMƏK** "Öyrətmək"dən *məch. Sənət öyrədilmək. Xarici dil öyrədilmək. Zəhmətə öyrədilmək.*

**ÖYRƏNCƏK** b a x **öyrəncə(k)li**. [Arvad:] *A kişi, sən onların evini yıxırsan. Öyrəncək olurlar*. M.Hüseyn.

**ÖYRƏNCƏ(K)Lİ** *sif.* Adətkərdə, öyrəşmiş, adət etmiş, vərdiş eləmiş, alışmış. *Mən torpağı bölünməyə öyrəncəliyəm; Heç qazanan görməmişəm bölənləri də..* M.Araz. [Gülnaz:] *Mən öyrəncəliyəm, – dedi, – heç bir şey olmaz.* Q.İlkin.

**ÖYRƏNCİ** 1. *is. köhn.* Öyrənən, şagird.

2. *dan.* b a x **öyrəncə(k)li**.

**ÖYRƏNİLMƏ** "Öyrənilmək"dən *f.is.*

**ÖYRƏNİLMƏK** "Öyrənmək"dən *məch. Klassiklər öyrənilir.*

**ÖYRƏNİŞ** *is.* Öyrənmə işi, öyrənmə; öyrənmə üsulu (tərzi). *Bu öyrənişdə .. insan hər şeydən əvvəl .. səadətverici vasitələri düzgün təyin etməlidir.* M.S.Ordubadi.

**ÖYRƏNİŞLİ** b a x **öyrəncəkli**.

**ÖYRƏNİŞMƏ** "Öyrənişmək"dən *f.is.*

**ÖYRƏNİŞMƏK** *f.* Alışmaq, vərdiş olmaq, öyrəşmək, isinişmək. *Rüstəm bəy mətanətli bir səslə: – Gün-gündən sizə öyrənişirəm.* Çəmənzəminli.

**ÖYRƏNMƏ** "Öyrənmək"dən *f.is.*

**ÖYRƏNMƏK** *f.* 1. Bilik əldə etmək, bir şeyi təcrübə ilə mənimsəmək. *Tarda çalmağı öyrənmək. İngilis dili öyrənmək. İşin texnologiyasını öyrənmək.* // Bir işlə (sənətlə, peşə ilə) məşğul olaraq ona sahiblənmək, yiyələnmək, bir sənət (peşə, ixtisas) əldə etmək. *Dərzilik peşəsi öyrənmək.* // Məşğul olaraq hazırlamaq, hazırlaşmaq. [Əsgər:] *Rəsul, .. heç olmasa kitabı əlinə al, barı görsün ki, guya dərsini öyrənirsən*. N.Vəzirov.

2. B a x **öyrəşmək** 1-ci mənada. *İstiyə öyrənmək. – Biz hərbiyyəlilər danüzü durmağa öyrənmişik*. Mir Cəlal.

3. Xəbərləşib, soraqlaşıb bilmək, məlumat əldə etmək, xəbər bilmək. *Vəziyyəti öyrənmək.* – [Xan Məmməd bəyə:] *..Bir öyrən gör Fətəlinin başında nə qədər adamı var.* Çəmənzəminli. *Lakin nə adını bilirdim, nə də kim və nəçi olduğunu öyrənə bilmişdim.* S.Hüseyn. // Məc. mənada. *Həyat nədir? Sual verdim özümə; Mənasını çiçəklərdən öyrəndim.* M.Müşfiq.

4. Tədqiq etmək, araşdırmaq, tədqiqat aparmaq. *Füzulinin yaradıcılığını dərindən öyrənmək. Çayın su rejimini öyrənmək.*

**ÖYRƏNMİŞ** *f.sif.* Alışmış, vərdiş etmiş, adət etmiş, öyrəncəli.

**ÖYRƏŞMƏ** "Öyrəşmək"dən *f.is.*

**ÖYRƏŞMƏK** *f.* 1. Vərdiş etmək, alışmaq, öyrənmək, adət etmək. *Qaratoyuq əsarətə* (*qəfəsə*) *tez öyrəşir, sonra oxumağa başlayır.* S.S.Axundov. [Tahir] *lap uşaqlıqdan dağ havasına alışdığı üçün Bakının istisinə hələ də öyrəşə bilmirdi.* M.Hüseyn.

2. İsinişmək, alışmaq, öyrənmək. *Yazıq Tamam bizim ailəyə öyrəşdiyindən ayrılmaq istəməyirmiş*. S.S.Axundov.

**ÖYRƏTMƏ** "Öyrətmək"dən *f.is.*

**ÖYRƏTMƏK** *icb.* 1. Bilik, sənət, peşə vermək, təlim etmək. [Adil:] [Atam] *əlləri salamat olan müharibə əlillərinə xarratlıq öyrədirdi.* B.Bayramov.

2. Bilmədiyi şeyi bildirmək, başa salmaq. *Bilmədiklərini öyrətmək. Bunları sənə kim öyrətdi?*

3. Vərdiş etdirmək, alışdırmaq. *İşə öyrətmək. Soyuğa öyrətmək.*

4. Bildirmək, tanış etmək, izah etmək. *Yolu öyrətmək.*

5. Dərs vermək. *Rus dili öyrətmək.*

6. *dan.* Sövq etmək, təhrik etmək (adətən mənfi mənada). *Pis işlərə öyrətmək. – Bizə meylin əzəlki tək nədən yox; Səni ha sonradan bir öyrədən yox.* M.P.Vaqif.

7. *məc.* Dərsini vermək, cəzalandırmaq, göstərmək. *Ona mən öyrədərəm*.

**ÖYÜD** *is.* Pis hərəkətlərdən saqındırmaq üçün deyilən sözlər; nəsihət. [Asya:] *Ha öyüd, nəsihət edirəm olmur. Görünür ki, qız gədəyə çox bərk bənd olubdur.* Ü.Hacıbəyov. *Əmdik bir ananın ilıq südünü; Baş-başa dinlədik hər öyüdünü.* S.Vurğun. ☐ **Öyüd almaq** – nəsihət almaq, tərbiyə almaq, məsləhət almaq. [Kərəm:] *Qana-qana öyüd*

*alıb anadan; Ay həzərat, gedən ceyran mənimdi!* "Əsli və Kərəm". **Öyüd vermək** – birini pis hərəkətlərdən saqındırmaq üçün öyüdlü sözlər söyləmək, nəsihət etmək. *Qulaq as, gör anan nə öyüd verir; Şərəflə, vüqarla yaşayın ancaq!* S.Vurğun. [Vahimə Çiçəyə:] *Ağbirçək arvadsan, niyə gəlininə öyüd verib demədin, xalqın .. evini dağıtma?* B.Bayramov.

**ÖYÜDLƏMƏ** "Öyüdləmək"dən *f.is.*

**ÖYÜDLƏMƏK** *f. dan.* Öyüd vermək, nəsihət etmək. *Uşağı öyüdləmək.*

**ÖYÜD-NƏSİHƏT** bax **öyüd**. [Məsumə Firəngizə:] *Yox, bala, bu, öyüd-nəsihət məsələsi deyil.* B.Bayramov. ☐ **Öyüd-nəsihət vermək (etmək)** – bax **öyüd vermək** ("**öyüd**"də). *Xan özünə bir az öyüd-nəsihət verirdisə də, ürəyindəki söz ona sakitlik vermirdi.* Çəmənzəminli. [Sultan bəy:] *..Siz Gülçöhrəyə öyüd-nəsihət edərsiniz, onu başa salarsınız.* Ü.Hacıbəyov.

**ÖYÜDVERİCİ** *sif.* Öyüd, nəsihət mahiyyətində olan; nəsihətli. *Öyüdverici sözlər.*

**ÖYÜMƏ** "Öyümək"dən *f.is.*

**ÖYÜMƏK** *f.* Ürəyi qalxmaq, ürəyi bulanmaq, qusmaq istəmək.

**ÖYÜNCƏK** bax **öyüngən**.

**ÖYÜNGƏN** *sif.* və *is.* Özünü çox öyən, tərifləyən, özünü tərifləməyi sevən, öyüncək (adam).

**ÖYÜNGƏNLİK** *is.* Öyüngən adamın xasiyyəti.

**ÖYÜNMƏ** "Öyünmək"dən *f.is. Ayrım qızının belə öyünməsindən, Kərim babanın elə sükut ilə büzülüb durmasından bir qəhqəhə qopdu.* A.Şaiq.

**ÖYÜNMƏK** *f.* 1. Özünü öymək, özünü tərifləmək; lovğalanmaq. // Fəxr etmək. *Öyünməsin kimsə gözələm deyib; Bir ayrı tövr olur halı gözəlin.* M.P.Vaqif. [Şərəfnisə xanım:] *Heç vaxt sən Parijə gedə bilməzsən. Ha vaxt getsən, öyün!* M.F.Axundzadə.

2. Arxalanmaq, bel bağlamaq, özünə arxa saymaq. *Öz övladlarına öyünmək. – Qovğa günü öyündüyüm nər dəlilər yerindəmi?* "Koroğlu".

**ÖZ** *əvəz.* 1. Şəxsinə, özünə aid olan, xas olan, mənsub olan. *Öz kitabı. Öz şeyi. Öz yerindən durmaq. Öz vətəninə qayıtmaq. Öz fikrində qalmaq. – Birdən* [İskəndərin] *tərlan qanadlı xəyalı uçub, öz vətəninə – doğma Azərbaycan elinə getdi.* Ə.Vəliyev. // Şəxsən, müstəqil olaraq özü tərəfindən yaradılmış, görülmüş, alınmış, əldə edilmiş və s. *Öz şeirlərini oxudu. Öz bostanını bizə göstərdi. Öz zəhmətinin məhsulu.* // Şəxsən özünə məxsus; şəxsi. *Öz maşını var. Öz ev-eşiyi. Öz kitabı. Paltolar arasında öz paltosunu axtarmaq. – Lakin Müqim bəy öz dərdini örtbasdır edə bilmirdi.* S.Rəhimov.

2. Ancaq özünə, yaxud bir şeyə xas; xüsusi. *Onun öz üslubu, öz metodu var. O, öz qəribəliyi ilə nəzəri cəlb edir. – ..Xudayar bəy zəmilərə cüt göndərib başladı sürdürməyə. Əkilmiş zəmiləri öz malı kimi biçirdi.* C.Məmmədquluzadə. *Bahadur öz gur və iti səsi ilə çağırdı..* S.Rəhman.

3. Doğma, yaxın (iş, məslək, əqidə və fikir cəhətdən). *Öz xalqımız. Öz adamımız. Öz uşağımız.*

4. Bir işdə şəxsən, bilavasitə iştirak edən (onun mənbəyi, ya obyekti olan) şəxsi, ya şeyi göstərmək üçün isimdən, şəxs əvəzliyindən sonra işlənir. *Atası özü oğlunu şəhərə apardı. O özü də çox əziyyət çəkdi. İşin özü çox maraqlıdır. Bütün işləri özüm görürəm. – Nəhayət, iri qayaların və kolların arasından çayın özü görünməyə başladı.* Çəmənzəminli. [Əsmər] *artıq Məmmədbağırı dinləmək istəməyirdi. Tələb edirdi ki, onu öz kəndlərinə göndərsin.* S.Hüseyn. *Həmişəyev əmr verdi ki, Hidayət .. Sənubərin layihəsini şəxsən onun özünə, baş memara təqdim eləsin!* B.Bayramov.

5. İsim və ya şəxs əvəzliyi yerində müstəqil işlədilir. *Özü yazıb. Özüm görmüşəm. –* [Aslan bəy:] *..Yaxın yerdən bilmişəm. Özü xəbər göndərmiş.* C.Cabbarlı. *Həyat nədir? Sual verdim özümə; Mənasını çiçəklərdən öyrəndim.* M.Müşfiq. // Eyni mənada bəzən cəm şəkilçisi ilə işlədilir. *Özləri bilərlər. Özləri getsinlər. – İşıqların yaratdıqları parıltılar işıqların özlərinin gözünü qamaşdırırdı.* B.Bayramov.

6. Bir adamın və ya bir şeyin böyüklüyünü, əhəmiyyətini, mövqeyini nəzərə çatdırmaq üçün işlədilir. *General özü gəlmişdi. Məni nazir özü qəbul etdi.*

◊ **Öz canı üçün qorxmaq** – öz həyatını qorumaq, öz canına ziyan dəyməməsinə çalışmaq. **Öz canının hayına qalmaq (hayında olmaq)** – özünü təhlükədən, qorxulu vəziyyətdən qurtarmağa çalışmaq, tədbir aramaq. *Həmzə indi burada öz canının hayında idi*. Ə.Əbülhəsən. **Öz əli, öz başı** – sərbəst, azadə. **Öz xoşuna qalmaq** – ixtiyarı özündə olmaq, özbaşına qalmaq. *Dövlətli baxır ki, qonşu öz xoşuna qalsa, bağçadan əl çəkməyəcək.* "M.N.lətif." **Öz xoşuna qoymaq** – sərbəst buraxmaq, öz istədiyi kimi hərəkət etməsinə imkan vermək, başlı-başına buraxmaq. **Özüdür ki var** – haqqında danışılan adamın və ya şeyin adı çəkildikdə, yaxud da onu gördükdə təsdiq məqamında işlədilən ifadə. *Dadaşov içəri girdi. Arıq kişi əvvəlcə yerindən tərpənmək istəmədi, sonra ürəyinə damdı ki, ucaboy bu adam elə Dadaşov özüdür ki var.* İ.Məlikzadə. **Özüm ölüm** – "canıma and olsun" mənasında and ifadəsi. **Özündə olmamaq** – özünü itirmək dərəcəsində hirslənmək, özündən çıxmaq. *İndi isə Əmiraslan baba Kərimqulunun özündə olmadığını gördü*. S.Rəhimov. **Özündən çıxmaq** – hirslənmək, əsəbiləşmək, coşmaq. *Bu sözdən Sərdar Rəşid özündən çıxmış*(*dı*).. M.S.Ordubadi. *Zeynal tamamilə özündən çıxdı.* S.Hüseyn. **Özündən dəm vurmaq** – özünü tərifləmək, özündən demək. **Özündən düzəltmək** – 1) başından çıxarmaq, fikirləşib tapmaq; 2) yalan demək, qondarmaq, uydurmaq. **Özündən getmək** – ürəyi getmək, bayılmaq, qəşş etmək, huşunu itirmək. *Mehribanın ürəyi xarab olub özündən getmişdi*. S.Hüseyn. *Gəlin bayaq acı bir fəryad çəkib özündən getdi*. Mir Cəlal. **Özündən küs!** – "özünü günahkar bil", "təqsir səndədir" mənasında işlədilir. **Özünə çıxmaq** – mənimsəmək, götürmək, özünə aid etmək, öz ayağına yazmaq. **Özünə gəlmək** – 1) huşu özünə gəlmək, ağlı başına qayıtmaq (qəşş etmiş, huşunu itirmiş adam haqqında). *Xəstə özünə gəldi*. – [Atdan yıxılıb ürəyi getmiş halda] *Nurəddin zəif səslə ufuldadı və sonra özünə gəlib İmamverdi babanı tanıdı.* S.S.Axundov. *Tərlan bir azdan sonra özünə gəldi*. M.Hüseyn; *Kişilər gülüşdülər, yaman gülüşdülər. Cavanşir isə sözü özünə götürüb pul kimi qızardı.* İ.Şıxlı; 2) b a x **özünü ələ almaq**; 3) əvvəlki vəziyyətinə gəlmək, sağalmaq, düzəlmək, əmələ gəlmək (ağır xəstəlikdən sonra). *Sevilin hər cür müalicəsinə .. baxmayaraq hələ də qız özünə gəlmir, səhhətini düzəldə bilmirdi.* S.Rəhimov; 4) bir hadisənin, işin mənasını sonradan başa düşmək. **Özünə gətirmək** – 1) ürəyi getmiş adamı ayıltmaq; 2) *məc.* ayıltmaq. *Onun vaxtı ilə söylədiyi bu söz məni lap özümə gətirdi.* M.S.Ordubadi. **Özünə görə** – öz vəziyyətinə, öz mövqeyinə, öz vəzifəsinə layiq. [İmamverdinin] *kənddə özünə görə yaxşı evi-mülkü vardı*. S.S.Axundov. **Özünə götürmək** – 1) başqası haqqında deyilən sözü özünə aid etmək; 2) b a x **özünə çıxmaq**. **Özünə gün ağlamaq** – öz taleyini, öz gələcəyini düşünmək; çətin vəziyyətdən çıxmaq üçün yol axtarmaq. **Özünü aparmaq** – özünü idarə etmək (rəftar, davranış, əxlaq məsələlərində). **Özünü bərkitmək** – 1) qüvvə yığmaq, özünü möhkəmləndirmək; 2) var-dövlət yığmaq, varlanmaq. **Özünü bilməmək** – huşunu itirmək. **Özünü çəkmək** – lovğalanmaq, təşəxxüs satmaq. *Yasavul .. özünü çəkdiyi vaxt bir neçə adam .. bir-birinə göz vurdu*. S.Rəhimov. **Özünü dartmaq** – b a x **özünü çəkmək**. [Xankişi Haqverdiyə:] *Gəl oyna, özünü dartma, bir görək; Qoy yenə sevinsin, açılsın ürək*. Z.Xəlil. **Özünü düzəltmək** – maddi cəhətdən vəziyyətini yaxşılaşdırmaq. **Özünü ələ almaq** – huşunu, fikrini, ifadəsini toplamaq, özünü toplamaq, ağır bir vəziyyətdə iradəli olmaq, özünü itirməmək; sakit olmaq. *Ürəyi tələssə də Həbib özünü ələ alır, toxtaq hərəkət eləyirdi.* Ə.Vəliyev. [Mülayim:] *Özünü ələ al, oğlum, yekə kişisən, mərd ol, möhkəm dur.* B.Bayramov. **Özünü ələ salmaq** – özünü gicliyə vurmaq, axmaq hərəkətlər etmək (giclik, yüngüllük edən adam haqqında). **Özünü göstərmək** – 1) öz üstünlüyünü, bacarığını göstərmək; 2) nümayiş etdirmək, təzahür etmək. *Burada ilk bahar bütün gücü və qüdrəti ilə .. özünü göstərirdi.* S.Rəhimov. **Özünü gözləmək** – özünü qorumaq, mühafizə etmək. [Səlim:] *Fırtınadan özünü gözlə!*

İ.Əfəndiyev. **Özünü xəstəliyə (dəliliyə** və s.**) vurmaq (qoymaq)** – yalandan özünü xəstə (dəli və s.) göstərmək. *Nuşapəri xanım özünü yuxuluğa vurdu.* (Nağıl). *Molla Xəlil özünü avamlığa qoymuşdu.* S.Hüseyn. **Özünü itirmək** – çaşmaq, nə edəcəyini bilməmək. *Ucaboy, qoca, lakin qıvraq hakim içəri girəndə evdəkilər özlərini itirdilər.* Mir Cəlal. *Fərman həmişə belə qoçaq və dilavər qızların yanında özünü itirərdi.* Ə.Sadıq. **Özünü naza qoymaq** – nazlanmaq, naz satmaq. **Özünü oda-suya (oda-közə) vurmaq (atmaq)** – bir iş üçün fədakarcasına çalışmaq, səyini, qüvvəsini əsirgəməmək, əziyyətə, məşəqqətə dözmək. **Özünü o yerə qoymamaq** – bir işə əhəmiyyət verməmək, özünü bilməməzliyə, eşitməməzliyə qoymaq. *Məmməd dostunun üz-gözündən hirsli olduğunu başa düşdüsə də, özünü o yerə qoymadı.* Ə.Əbülhəsən. **Özünü ortaya salmaq (atmaq)** – özünə aid olmayan işə qarışmaq. **Özünü öldürmək** *məc.* – çox zəhmət çəkmək, çox əlləşmək, çox çalışmaq. *Özünü öldürüb ev tikmək.* **Özünü öymək** – özünü tərifləmək, lovğalanmaq. **Özünü saxlamaq** – iradəsini toplayıb bir işi görməkdən vaz keçmək, saqınmaq, etmək istədiyi bir işi etməmək. *Nurəddin özünü saxlayıb qəsdən* [atasının meyitinin üstündə] *ağlamırdı ki, Gülpəriyə oxşamasın.* S.S.Axundov. *Mehribanı gic bir gülmək tutdu, özünü saxlaya bilmədiyindən bayıra çıxdı.* S.Hüseyn. **Özünü sındırmamaq** – pərt olmamaq, özünü tox tutmaq. *Gəlin sapsarı saralsa da, özünü sındırmadı.* İ.Şıxlı. **Özünü soyuğa vermək** – soyuq dəyib naxoşlamaq. *Bir dəfə Həlimə hamamdan çıxanda özünü soyuğa verib, yorğan-döşəyə düşdü.* S.S.Axundov. **Özünü tanımaq** – həddi-büluğa çatmaq. *Elə ki Məhəmmədhəsən əmi özünü tanıdı, gözünü açdı, baxdı gördü, qalıbdı lap lüt-madərzad.* C.Məmmədquluzadə. **Özünü təmizə (təmizliyə) çıxarmaq** – özünə bəraət qazandırmaq, müqəssir olmadığını isbat etməyə, sübuta çalışmaq. **Özünü toplamaq** – bir şey qarşısında, ya bir şey etmək üçün qüvvə və iradəsini toplamaq. *Surxay özünü topladı, irəli atıldı.* M.Hüseyn. *Əbil özünü toplayıb qəddini düzəltdi, mənalı-mənalı Gülsəhərin üzünə baxdı.* Ə.Vəliyev. **Özünü tutmaq** – qeyri-qanuni yollarla varlanmaq. *Xandəmirov çaldı, çapdı mahalı; O ki var tutub özün keçəl qurumsaq.* Q.Zakir. **Özünü yetirmək** – çatdırmaq, vaxtında gəlib çıxmaq. *Özünü qatara yetirdi. Özünü hadisə yerinə yetirdi. – Dərviş şəhərdən çıxıb özünü yetirdi başqa şəhərə.* (Nağıl). **Özünü yeyib tökmək** – çox təşviş və iztirab keçirmək, narahat olmaq, əsəbiləşmək. **Özünü yığışdırmaq** – 1) fikrini, huşunu, qüvvəsini toplamaq, özünü ələ almaq. *Dostlar özlərini yığışdırıb, İskəndərə qahmar çıxınca kişini camaat qabağında mühakimə elədilər.* Mir Cəlal. *Qız birtəhər özünü yığışdıraraq mühəndisin üzünə baxdı.* Ə.Sadıq; 2) qəzəb, narazılıq doğurmamaq üçün öz hərəkətlərinə, davranışına fikir vermək, özünü düzəltmək. *Rüstəm kişinin acıqlanaraq şapalağı işə salacağından qorxub, Salman özünü yığışdırdı..* M.İbrahimov; 3) **özünü yığışdır!** şəklində – hədə, qorxu məqamında işlədilir. **Öz-özlüyümdə (öz-özlüyündə)** – bax **özlüyündə**. *Öz-özlüyündə qərara gəlmək.* – [Qüdrət:] *Mən dinlədiyim adamların fikrini öz-özlüyümdə saf-çürük etmişəm.* M.Hüseyn. **Öz-özlüyündə** – ayrılıqda, ayrılıqda götürdükdə. *Öz-özlüyündə o şeyin heç bir qiyməti yoxdur.* **Öz-özünə** – 1) öz bildiyi kimi, müstəqil olaraq; özü. *Öz-özünə fikirləşmək. Öz-özünə öyrəşmək*; 2) yavaşcadan, kimsə eşitmədən. *Öz-özünə oxumaq.*

**ÖZBAŞINA** *zərf* Öz bildiyi kimi, heç kəsdən soruşmadan, icazə almadan. *Sabir .. söz verdi ki, bir də özbaşına belə yerə çıxmaz.* S.Rəhimov. [Rəis:] *Şahinin nə ixtiyarı var ki, ştatda yer olmaya-olmaya özbaşına adam götürür?* S.Rəhman. // Nəzarətsiz, baxımsız, başlı-başına. *Uşaqları özbaşına qoymaq olmaz.* – [Şəhrəbanu xanım:] *Hələ bir de görüm, sən özbaşınasan, ya sənin atan yerində bir böyüyün var?* M.F.Axundzadə. *Kərim babanın inəkləri özbaşına buraxması sahiblərinin xoşuna gəlməzdi.* A.Şaiq. *İstər-istəməz Züleyxa özbaşına buraxılmışdı.* M.İbrahimov.

**ÖZBAŞINALIQ** *is.* Hər hansı bir işdə qanuna, intizama, qəbul olunmuş nizam və qay-

daya zidd hərəkət; başlı-başınalıq. *Hacı Mirzağa Bülluri və Kəlbə Hüseyn Fişəngçinin bu hərəkəti özbaşınalıqdır.* M.S.Ordubadi. *Zeynal əvvəl qışqır-bağırla bu özbaşınalığın qabağını almaq istəyirdi.* Ə.Əbülhəsən.

**ÖZBƏK** *is.* Özbəkistan Respublikasının əsas əhalisini təşkil edən türkdilli xalq və bu xalqa mənsub adam.

**ÖZBƏKCƏ** *sif.* və *zərf* Özbək dilində. *Özbəkcə öyrənmək. Özbəkcə qəzet.*

**ÖZCƏ** *sif.* Özünə aid olan; özünün. *Özcə işinlə məşğul ol.* – [Şahpəri:] *Mən hesabdarzad hesaba alan deyiləm. Hərə getsin özcə dərdini çəksin.* B.Bayramov.

**ÖZCÜYƏZ** *əvəz.* "Öz"dən *oxş.* [Gülöyşə Sənubərə:] *Qoy özcüyəzi görüşsün, danışsın.* B.Bayramov.

**ÖZƏK** *is.* 1. Bitki gövdəsinin və ya kökünün daha yumşaq olan daxili mərkəzi hissəsi.

2. Çibanın, çirkli yaranın ortasında olan bərk iltihablı hissə. *Çibanın özəyi.* ☐ **Özək bağlamaq** – b a x **özəkləmək**. *Yara özək bağladı.*

3. Böyük bir birləşmənin əsas tərkib hissəsini təşkil edən kiçik təşkilat qrupu; əsas, özül. [Barat:] *Dərsdən sonra özəyimizin iclasını çağırmışam.* C.Cabbarlı. *Dilşad özək iclaslarında .. müəyyən çıxışlarda bulunur, ümumun təqdirini qazanırdı.* T.Ş.Simurq.

**ÖZƏKLƏMƏ** "Özəkləmək"dən *f.is.*

**ÖZƏKLƏMƏK** *f.* Özək əmələ gəlmək, özək bağlamaq. *Çiban özəkləyib.*

**ÖZƏKLİ** *sif.* Özəyi olan, özək bağlamış.

**ÖZFƏALİYYƏT** *is.* İncəsənətdə (musiqi, teatr, xor və s.) peşəkar olmayan şəxslərin bədii yaradıcılıq fəaliyyəti. *Özfəaliyyət dərnəkləri.* – [Rəşid] *ümumittifaq özfəaliyyət icraçıları baxışında birincilik qazanmışdır.* M.Rzaquluzadə. [Sədəf:] [Xosrov] *özfəaliyyət baxışlarında həmişə təriflətdi.* B.Bayramov.

**ÖZGƏ** *sif.* 1. Başqa, digər. *Özgə məsələ. Özgə vaxt gələrsən.* – *Bundan əlavə, dəxi Yusif şahda həzar gunə özgə eyblər tapdılar.* M.F.Axundzadə. // Aid olduğu sözə xüsusi emosionallıq verir. *İlin hər fəslinin bir hüsnü var, amma qışın ləzzəti bir özgədir.* C.Məmmədquluzadə. *Deyirlər ki, evli olmağın, uşaq babası olub külfət arasında ömür sürməyin özgə bir ləzzəti var.* A.Divanbəyoğlu.

2. Həmin cəmiyyətə, kollektivə, ailəyə mənsub olmayan. *Özgə uşaq.* – [Müəllim:] *Mən ki özgə adam deyiləm.* H.Nəzərli.

3. *İs. mənasında.* Kənar, yabançı, yad, özgəsi. [Dilbər:] *Özgələri min iş görürlər, karvanı malı ilə yeyirlər, sarvanı şalı ilə.* C.Cabbarlı. [Sərvər:] *Rüstəm bəy Gülnazı özgəsinə ərə verir.* Ü.Hacıbəyov.

4. *Qoşma vəzifəsində.* Digər, başqa. *Bahar fəsli el şad olur sərasər; Hərgiz məndən özgə yoxdur mükəddər.* Q.Zakir.

**ÖZGƏYERLİ** *is.* Yad, başqa yerli, gəlmə; yadelli.

**ÖZGÜN** *sif.* Özünəməxsus, özünə xas olan, orijinal. *Sabir, İran tacirlərinin alayarımçıq işlərini, verdikləri vədə xilaf çıxmalarını özgün tərzdə tənqid edərək, onları kasıb balalarının şövqlə oxumalarını gözləri götürməməkdə, dargözlükdə günahlandırırdı.* "Hophopnamə".

**ÖZLƏMƏ** "Özləmək"dən *f.is.*

**ÖZLƏMƏK** *f. şair.* Bir daha görmək və ya qovuşmaq arzusunda olmaq; görmək istəmək, arzulamaq, həsrətində olmaq. [Şeyx Kəbir Sənana:] *Cahil-arif, böyük-kiçik yeksər; Səni özlər, sevər, pərəstiş edər.* H.Cavid. *Çeynəndi, tapdandı özlədikləri; Gözlərində qaldı gözlədikləri.* M.Müşfiq.

**ÖZLÜ** *sif.* Yapışqanlı, yapışqan kimi; yarımqatı. *Özlü maddə.*

**ÖZLÜLÜK** *is.* Yapışqanlılıq, qatılıq. *Məhlulun özlülük dərəcəsi.*

**ÖZLÜYÜNDƏ** *zərf* 1. Öz fikrində, öz aləmində, öz düşüncəsində, öz-özlüyündə. *Özlüyündə fikirləşmək.* – *Tapdıq özlüyündə sevindi ki, nə yaxşı ki, müəllim gəlib çıxmır.* Ə.Vəliyev. *Qoca isə özlüyündə Qəhrəmanla danışıb əylənirdi.* S.Rəhimov.

2. Ayrıca götürüldükdə, təklikdə; öz mahiyyəti etibarilə. *Bu mövzu özlüyündə şagirdlərin mənimsəməsi üçün çox çətindir.*

**ÖZÜAÇILAN** *sif.* Öz-özünə açılan, avtomatik surətdə açılan. *Özüaçılan qapılar.*

**ÖZÜBOŞALDAN** *sif.* Banı yana və ya arxaya çevrilməklə özü yükünü boşaldan (avtomaşın haqqında). *Yükünü özüboşaldan avtomobil.*

**ÖZÜL** *is.* Bünövrə, təməl, əsas. *Binanın özülü. – Qoyuldu özüllər, boylandı tağlar; Tikildi divarlar, şumal dirəklər.* M.Müşfiq. *Binanın özülünü qoymaq üçün bütün hazırlıq işləri görülmüşdür.* Z.Xəlil. // Məc. mənada. *Məktəbdə müəllim, evdə ana... Ana tərbiyəsi isə özüldür.* S.Rəhimov.

**ÖZÜLLÜ** *sif.* Özülü olan, bünövrəli.

**ÖZÜLSÜZ** *sif.* Özülü, bünövrəsi olmayan; bünövrəsiz, təməlsiz. *Bina tez uçular özülsüz olsa; Əməl də düz olar şüur düz olsa.* B.Vahabzadə.

**ÖZÜMÜNKÜ, ÖZÜMÜZÜNKÜ** 1. *əvəz.* Özüm(üz)ə aid olan, özüm(üz)ə məxsus olan; mənimki, bizimki. *Kitablar özümü*(*zü*)*nküdür.*

2. İs. mənasında adətən cəm şəklində: **özüm(üz)ünkülər** – mənə, bizə yaxın olan adamlar, yoldaşlarım(ız). *Özümü*(*zü*)*nkülər gəldilər.* – [Südabənin anası:] *Qonum-qonşu dövrəmə yığışsın, gözümü özümüzünkülər bağlasınlar.* M.İbrahimov.

**ÖZÜNDƏNBƏY** *is. zar.* Özünü böyük göstərməyə çalışan adam. *Özündənbəyin biridir.*

**ÖZÜNDƏNGETMƏ** *is.* Hissini, huşunu itirmə; qəşş etmə, ürəkkeçmə.

**ÖZÜNƏBƏY** b a x **özündənbəy**.

**ÖZÜNƏXİDMƏT** *is.* Özü-özünə xidmət etmə, öz məişət və s. ehtiyaclarını özü təmin etmə. *Özünəxidmət mağazası.*

**ÖZÜNƏNƏZARƏT** *is.* Öz hərəkətinə, işinə, səhhətinə nəzarət etmə. *Özünənəzarət həkim nəzarətini tamamlayan mühüm vasitədir.*

**ÖZÜNÜÇƏKƏN** *sif.* Özünü başqalarından yüksək tutan; lovğa, təkəbbürlü, özünü dartan. *Əsədüddövlə təkəbbürlü, özünüçəkən, ağızdan cəfəng bir adam idi.* P.Makulu.

**ÖZÜNÜDARTAN** b a x **özünüçəkən**.

**ÖZÜNÜİDARƏ** *is.* 1. Hər hansı bir təşkilatın, cəmiyyətin, təsərrüfat, yaxud inzibat vahidinin və s. öz daxili işlərini yerli qüvvələrlə həll etmə hüququ. [Mürtəcelər] *1920-ci ildə Şeyx Məhəmməd Xiyabaninin Təbrizdə yaratdığı demokratik özünüidarə üsulunu .. məhv etdilər.* M.İbrahimov.

2. B a x **muxtariyyət**.

**ÖZÜNÜQORUMA** *f.* Özünü təhlükədən, zərbədən və s.-dən mühafizə etmə, qoruma. *Zədələnmənin qarşısını almaq üçün qoruma və özünüqoruma tədbirlərinin çox böyük əhəmiyyəti vardır.*

**ÖZÜNÜMÜDAFİƏ** *is.* Özünü hər hansı bir təhlükədən, hücumdan, düşmən hərəkətlərindən öz qüvvəsi ilə müdafiə etmə. *Özünümüdafiə tədbirləri. Özünümüdafiəyə hazır olmaq.*

**ÖZÜNÜMÜŞAHİDƏ** *is.* Öz üzərində müşahidə aparma, öz-özünü müşahidə etmə; öz hərəkətləri, hissləri, fikirləri üzərində müşahidə aparma.

**ÖZÜNÜNKÜ** 1. *əvəz.* Özünə məxsus olan, özünə aid olan. *Paltar özününküdür.*

2. *İs. mənasında.* Öz adamı, öz qohumu, öz yaxını, yaxud öz şeyi, öz fikri və s. [Tutubəyim ağa:] *Qızım, bir özününkülərdən də oxu, .. qulaq assın.* Çəmənzəminli.

**ÖZÜNÜTƏNQİD** *is.* Öz işindəki nöqsanları aradan qaldırmaq üçün öz səhvlərini göstərərək tənqid etmə. *Tənqidi və özünütənqidi genişləndirmək.*

**ÖZÜNÜTƏRBİYƏ** *is.* Özünü tərbiyə etmə.

**ÖZÜYAZAN** *sif.* Hər hansı göstəriciləri avtomatik surətdə qeyd edən. *Özüyazan cihaz.*

**ÖZÜYERİYƏN** *sif.* Öz dartı qüvvəsi ilə hərəkət edən. *Özüyeriyən kombayn.*

# Pp

**P** Azərbaycan əlifbasının iyirmi üçüncü hərfi. b a x **pe**.

**PAÇA** *is.* [*fars.* paçə – kiçik ayaq] 1. Bədənin, iki qıçın arasındakı hissəsi. *Ördək qaz yerişi yeriyəndə paçası aralı qalar.* (Ata. sözü). *Teymur ağa təngə gəlib, bir əlilə yapışıb onun boynunun ardından, bir əlilə paçasından qaldırıb tullayır.* M.F.Axundzadə. *Bir qədər yol gedəndən sonra görürsən yabı öz yabılığını bildirdi: qulaqlar sallandı, paçanın arası köpükləndi, boyun düşdü, yabı yoruldu.* Ə.Haqverdiyev. *İdrisov oturduğu yerdə əllərini paçasının arasında qoşalaşdırdı.* İ.Məlikzadə. // Baldır; ayağın dizdən aşağı hissəsi. [Qız] *iki-üç yaşlı, paçası açıq bir oğlan uşağının lap böyründə durmuşdu.* M.İbrahimov.

2. Qoyun, keçi və malın ayrıca satılan dizdən aşağı hissəsi (ayaq və baldırları). // Bunlardan hazırlanan yemək.

**PAÇABƏND** *is.* [*fars.*]: **paçabənd etmək (eləmək)** – b a x **paçalamaq**. [Mirzə Səttar:] *Xux, yeyərsiz məni, çox böyük adamlar gəlir, onları paçabənd eyləyib qoyaram altıma.* M.Əliyev.

**PAÇALAMA** "Paçalamaq"dan *f.is.*

**PAÇALAMAQ** *f.* Paçasından tutmaq; yapışmaq, paçabənd etmək. *Nuşapəri xanım səbir eləyə bilməyib tez yorğan-döşəkdən durdu, qarını paçalayıb, qoydu dizinin altına.* (Nağıl). [Feyzi] *cəsarətlə sürünün içinə yeriyib, ala əmliyi paçaladı..* B.Bayramov.

**PADAR** *is.* Türk tayfalarından birinin adı və həmin tayfaya mənsub olan adam.

**PADŞAH** *is.* [*fars.*] 1. Hökmdar, imperator, şah, sultan. *Qoy səndən kiçiklər çapsınlar, sən çapma. Yalnız böyük padşahların qarşısında ad qazanmaq və ya özünü göstərmək üçün çapmağına dəyər.* "Qabusnamə".

2. *məc. dan.* Yarışda, oyunda, məclisdə və s.-də başçılıq edən adama verilən ad. *Yat, yat, İmamqulu! – deyə birdən padşah çığırdı, – yat, yat!* Çəmənzəminli. *Toy məclisidir. Qoçu Əsgər padşah olub, yuxarı başda əyləşibdir.* Ü.Hacıbəyov.

**PADŞAHLIQ** *is. köhn.* 1. Padşah vəzifəsi; şahlıq. *Məlik Çoban çox ədalətlə padşahlıq etməyə, camaatla yaxşı rəftar etməyə başladı.* (Nağıl).

2. Padşah tərəfindən idarə olunan dövlət quruluşu; şahlıq, imperatorluq. *Padşahlığı yıxmaq. – Xəlifədən gələn nümayəndələr də Qızıl Arslanın padşahlığı qəbul etməsini təklif edirdilər.* M.S.Ordubadi.

3. Bir padşahın hakimiyyəti altında olan ərazi, ölkə, məmləkət. *Padşahlığı idarə etmək.*

4. Padşaha mənsub, padşah hökumətinə məxsus; dövləti. [Vəli bəy:] *Padşahlıq dumasının vəkili olmaq xatalı işdir.* S.S.Axundov. [Ağa Məhəmməd şah Qacar:] *Rəiyyət məhəbbəti qazanmaq padşahlığın ilk vəzifəsidir.* Ə.Haqverdiyev.

**PADŞAHPƏRƏST** *is.* [*fars.*] Padşah tərəfdarı, padşahlıq üsuli-idarəsi tərəfdarı; monarxist.

**PADŞAHPƏRƏSTLİK** *is.* Padşah üsuli-idarəsinə tərəfdar olma, onu yeganə dövlət üsulu kimi qəbul etməkdən ibarət mürtəce siyasi cərəyan.

**PADŞAHYANA** *sif. köhn.* Padşaha layiq, padşahlarda olduğu kimi; şahanə. *Kişi gedib bazardan bir dəst padşahyana libas aldı..* (Nağıl).

**PADZƏHƏR** *is.* [*fars.*] Zəhərə qarşı maddə, dərman. *İbn-Sina* "*Həkimlik sənətinin qanunu*" *adlı kitabda .. padzəhərlər haqqında ətraflı məlumat vermişdir*. R.Əliyev.

**PÁFOS** [*yun.* pathos – ehtiras] 1. Ehtiraslı ruh yüksəkliyi; təmtəraq. *Pafosla danışmaq. Yalançı pafos. – Direktor .. saçlarını əsdirərək, tragik aktyor pafosu ilə ağlamsındı.* M.Hüseyn.

2. Hər hansı bir yüksək ideyanın doğurduğu şövq, ilham, vəcd, ruh yüksəkliyi, coşqunluq, ehtiras. *Romantika Almazın enerjisində, yaradıcılıq pafosunda, onun cəsarət və fədakarlığında, onun nikbinliyində, gələcək gözəl həyata olan inam və ümidindədir.* M.Arif.

**PAFOSLU** *sif.* Ehtiraslı, coşqun, təmtəraqlı. *Pafoslu nitq. Pafoslu çıxış.*

**PAH** *nida*. Təəccüb, təəssüf, kədər kimi hissləri ifadə edir. *Pah, nə pis oldu. Pah, nə çox kitabın var. Pah, yaman işə düşdük.*

☐ **Pah atonnan** *dan.* – cümlənin əvvəlində işlənərək təəccüb bildirir. *Pah atonnan, nə ağır yatdı bu oğlan, ölübə! Nə də tərpənməyir üstündəki yorğan, ölübə!..* M.Ə.Sabir.

**PAHO** b a x **pah**. [Hamı:] *Paho! Bu nə işdir, .. belə də adam aldatmaq olarmı?* Ü.Hacıbəyov. *Paho, strajnik gəlib ki, xoş gördük! – deyə Əhməd irəli gəlib Fərmanla görüşdü.* Ə.Abasov.

**PAXAR** *is.* Uzaq Şərqdə yaşayan etnik azlıqlar qrupu və həmin qrupa mənsub olan adam.

**PAXIL** *sif.* [*ər.* bəxil] Başqasının üstünlüyünə, xoşbəxtliyinə, rifahına, müvəffəqiyyətinə, qabağa getməsinə dözməyən, bundan dilxor olan, bunu gözü götürməyən; dargöz. *Paxıl adam. – Bir adam paxıl olsa; Ömrü boyu dərd çəkər.* (Bayatı). // İs. mənasında. *Paxılın biridir. – Ürək sındırmadım, qəlb incitmədim; Paxıllar yüz yerdən çəkdi dağ mənə.* B.Vahabzadə.

**PAXILLIQ** *is.* Başqasının rifahına, üstünlüyünə, müvəffəqiyyətinə, xoşbəxtliyinə, qabağa getməsinə dözməmə, bundan dilxor olma, acıqlanma; gözügötürməzlik, dargözlük. [Hacı Fərəc:] *..Hər nə danışırlar qoy danışsınlar, .. hamısı paxıllıqdır.* N.Vəzirov. *Üzümə dost kimi bəzən gülürsən; Dalda paxıllıqdan yanıb ölürsən.* S.Vurğun. ☐ **Paxıllıq etmək** – dargözlük etmək, gözügötürməzlik etmək. *Mahmuda xarici görünüşünə görə paxıllıq edənlər də olurdu.* S.Vəliyev. **Paxıllığı tutmaq** – b a x **paxıllıq etmək**. *Səfa elə baxır, elə bil ölümə məhkum olunmuş Hüsnübəyimə paxıllığı tutur, qibtə eləyir...* İ.Məlikzadə. **Paxıllığını çəkmək** – b a x **paxıllıq etmək**. [Dəmir:] *Sizin Qarabağ bəyləri həmişə bir-birinin paxıllığını çəkirlər..* Ə.Vəliyev.

**PAXIR** b a x **pas**. *Baxıb saxta gözümüzlə; Hamar gördük çuxuru biz; Saray bildik axuru biz; Görəmmədik qat bağlayan paxırı biz.* B.Vahabzadə.

**PAXIRLANMA** "Paxırlanmaq"dan *f.is.*

**PAXIRLANMAQ** b a x **paslanmaq**.

**PAXIRLI** b a x **paslı**. *Qumru qalayı getmiş, paxırlı tiyançanı gətirib küncə qoydu.* Mir Cəlal. [İlyas:] *Yanımdakı kolların paxırlı yarpaqlarında bir-iki iri yağış damlası tappıldadı.* Ə.Məmmədxanlı.

**PAXLA** *is.* İçində iri dənələri olan bostan bitkisi. *Paxlanı becərmək.* // Həmin bitkinin plova qatılan iri toxumu.

**PAXLALI** *sif.* İçində paxla olan, paxla ilə bişirilmiş. *Paxlalı aş.* ☐ **Paxlalı bitkilər** – b a x **paxlalılar**. *Paxlalı bitkilər əkilən sahələrin torpağı azot birləşmələrilə zənginləşir və münbit olur.* H.Qədirov.

**PAXLALIQ** *is.* Paxla əkilmiş yer, paxla tarlası. *Paxlalığı suvarmaq.*

**PAXLALILAR** *cəm bot.* Paxla məhsulu verən bitki fəsiləsi.

**PAXLAPLOV** *is.* Paxla və düyüdən bişirilən plov növü, paxlalı plov.

**PAXLAVA** *is.* 1. Yayılmış xəmir qatları arasına döyülmüş badam (fındıq, qoz və s.) ləpəsi ilə şəkər tozu tökülən və romb şəklində kəsilərək bişirilən Şərq şirniyyatı. [Varlılar] *bayrama xüsusi şəkərçörəyi, badamçörəyi, paxlava və sair bu kimi şirniyyat bişirib hazırlardılar.* H.Sarabski.

2. Paxlava (romb) şəklində naxışları olan. [Kişinin] *qırxılmış başında paxlava çəkili ağ araqçın vardır.* H.Sarabski.

**PAK**[1] *sif.* [*fars.*] Təmiz. *..Hava gərək təmiz olsun, onun pak olmağı həyat və xarab olmağı ölümdür.* H.Zərdabi. // Məc. mənada. *Cəhd eylə, sən ancaq nəzəri-xəlqdə pak ol.* M.Ə.Sabir. [Budağın] *əxlaqı, pak və səmimi ürəyi .. onu müəllimlərə .. çox sevdirdi.* Ə.Vəliyev. // *məc*. Müqəddəs, mübarək, əziz. *..Özgələr önündə pak görünməsi; O, hələ bilmir ki, ləkədir ona.* B.Vahabzadə.

**PAK**[2] *is.* [*ing.* pack] Qütb dənizlərində yaranan çox iri çoxillik üzən buz. *Pakın qalınlığı 3-5 metr olur.*

**PÁKER** *is.* [*ing.*] Quyunun neft, su və qaz təbəqələrini bir-birindən ayıran qurğu.

**PAKET** *is.* [*fr.*] 1. İçərisinə məktub qoyulmuş konvert, zərf. *Pristav əlini cibinə salıb, göy bir paket çıxarıb açdı.* H.Nəzərli. *Firidun paketi açdı, ikicə sətir yazılmışdı.* M.İbrahimov.

2. Kağıza bükülmüş bir və ya bir neçə şey; bağlama. // İçinə ərzaq və s. qoyulmaq üçün kağız kisə. *Mağazada şeylər paketdə satılır.*

◊ **Fərdi paket** – özünün və ya başqasının yarasını sarımaq üçün xüsusi surətdə bağlanmış sarğı.

**PAKİZƏ** *sif.* [*fars.*] 1. Bax **pak**. [Seyid:] *Təmizcə, pakizə müsəlman nömrələri saxlayıram..* Ə.Haqverdiyev.

2. *məc.* Yaxşı, gözəl, qəşəng. [Hacı Nuru:] *Mərhum zəhmət çəkib sənə pakizə dəlləklik öyrətmişdi.* M.F.Axundzadə. *Bu yaxında Məşədi Şərbətəlinin yaxşı, pakizə restoranı var.* Ə.Haqverdiyev. ☐ **Çox pakizə** – çox yaxşı, çox gözəl (bir şeyi bəyənmək, yaxud bir sözü təsdiq etmək məqamında işlənir). [Soltan bəy:] *Çox gözəl, çox pakizə! Balam, heç sənin insafın-zadın yoxdur?* Ü.Hacıbəyov. [Rəhim bəy:] *Çox gözəl, çox pakizə! Elə mənim də axtardığım beləsi idi.* M.Hüseyn.

**PAKİZƏLİK** *is.* Paklıq, təmizlik.

**PAKLAMA** "Paklamaq"dan *f.is.*

**PAKLAMAQ** *f.* Murdar sayılan bir şeyi yumaqla pak etmək; təmizləmək. *İt yalamış qabı paklamaq.*

**PAKLANMA** "Paklanmaq"dan *f.is.*

**PAKLANMAQ** *f.* Təmizlənmək, yuyulub təmizlənmək. // *qayıd.* Yuyunub təmizlənmək. *Biz indi dünənin çirkablarından; Necə təmizlənək, necə paklanaq?* B.Vahabzadə.

**PAKLIQ** *is.* 1. Təmizlik.

2. *məc.* Mənəvi təmizlik, daxili saflıq. [Mahmud:] *O gecə cəmi ömrümün gözəlliyini, paklığını, salamatlığını beş dəqiqəyə qurban verdim.* Çəmənzəminli.

**PAKT** [*lat.*] Adətən böyük siyasi əhəmiyyəti olan beynəlxalq müqavilə. *Hücum etməmək haqqında pakt. Paktı imzalamaq.*

**PAQQAPAQ** *təql.* Qaynayan mayedən çıxan səs. *Samovar paqqapaq qaynayır.*

**PAQQILDAMA** "Paqqıldamaq"dan *f.is.*

**PAQQILDAMAQ** *f.* Paqqıltı səsi çıxarmaq, paqqapaq qaynamaq. *Qazan paqqıldayır.* // Qaynayan, yaxud bir qabın boğazından çıxan su haqqında. *Durna bulağının daş şırranına söykənmiş balaca qırmızı sənəyin boğazından çıxan ağappaq su paqqıldayır.* S.Rəhimov.

**PAL** *is.* Təzə qozun üst göy qabığı. [Veys] *..üstünə salınmış qurama yorğana, keçən il qoz palı ilə boyanmış bez mütəkkəyə işarə ilə dedi..* Ə.Əbülhəsən.

**PALAN[1]** *is.* [*fars.*] 1. Minik üçün istifadə edilən heyvanların belinə qoyulan içi saman, ya küləşlə dolu primitiv yəhər. *Ağa, palanı çox gözəl xalçadan tikilmiş bir uzunqulaq minmişdi.* M.S.Ordubadi.

2. Keçmişdə: hambalların dallarına qoyduqları xüsusi yastıq. *Bir palan tikdir, yüngül taylardan-zaddan daşı, hamballıq elə.* (Nağıl). *Burda döngələrin yeri darısqal; Oturmuş palanın üstündə hambal.* S.Vurğun.

3. *məc. dan.* Qalın, ağır, kobud geyim haqqında. *Bu palto deyil, palandır.*

**PALAN[2]** *is.* ["plan" sözünün danışıqda işlədilən təhrif olunmuş forması] Şəhərin bir neçə evdən ibarət hissəsi; məhəllə, küçə. [Hacı Cəfər:] *Mən çıxarmayacağam, pristav çıxardacaq, odur bax, palanın tinində durubdur.* N.Vəzirov.

**PALANDUZ** *is.* [*fars.*] *köhn.* 1. Palan tikən usta.

2. İri qıyıq; çuvalduz.

**PALANLAMA** "Palanlamaq"dan *f.is.*

**PALANLAMAQ** *f.* Heyvanın dalına palan qoymaq; çullamaq (bax **palan[1]** 1-ci mənada). [Mürşüdoğlu:] *Öküzü palanlayıb göndərdim.* S.Rəhimov. *Aslan kişi gecə yarı olmamışdan yerindən qalxıb, paltarını, çarıq-corabını geyindi, eşşəkləri palanladı.* Ə.Vəliyev.

**PALANLI** *sif.* Dalında palanı olan; çullu. *Bir gün .. palanlı ata minmiş bir qocanı darvazamızın ağzında durmuş gördüm.* S.S.Axundov.

**PALATA** [*lat.* palatium – saray] 1. Xəstəxanalarda və müalicə müəssisələrində xəstələr yatan otaqlardan hər biri. *Bir az sonra həkim palataları gəzəcəkdi.* Ə.Əbülhəsən.

2. Bəzi ölkələrdə nümayəndəlik orqanlarının adı. *Aşağı palata* (bir sıra ölkələrdə birinci qanunvericilik instansiyası). *Yuxarı palata* (bir sıra ölkələrdə ali qanunvericilik instansiyası).

3. Müəyyən işlə məşğul olan bəzi dövlət idarələrinin adı. *Kitab palatası. Ticarət palatası. Çəki və ölçü palatası.*

**PALAZ** *is.* Yundan və ya pambıqdan toxunma enli, uzun, qalın, xovsuz xalça növü. *Hücrənin fərşi ibarətdi bir palazdan.* C.Məmmədquluzadə.

**PALAZQULAQ** *sif.* 1. Qulaqları çox yekə olan; iriqulaqlı, yekəqulaqlı. *Palazqulaq adam.*

2. *məc. dan. zar.* İri kağız pula zarafatla verilən ad. *Palazqulaq iyirmibeşlik. – Bir*

*palazqulaq yüzlük* [məhkəməyə], *bir palazqulaq yüzlük də pristavın ovcuna basdıq, qurtardı*. M.S.Ordubadi.

**PALAZLIQ** *sif.* Palaz toxumaq üçün yarayan, palaz toxumaq üçün ayrılmış. *Palazlıq iplik*.

**PALAZTOXUYAN** *sif.* və *is.* Palaz toxumaqla məşğul olan (adam).

**PALÇIQ** *is.* 1. İslanaraq horra halına gəlmiş torpaq. *Ayaqqabılarını palçığa batırmaq*. – ..*Yolun palçığından tərpənmək olmayırdı.* Ə.Haqverdiyev.

2. Müalicə məqsədilə istifadə olunan dəniz, yaxud çay lili və ya tərkibində müxtəlif üzvi maddələr olan neft, su ilə torpaqdan ibarət zığ. *Naftalan palçığı.*

3. Keçmişdə bədəndəki tükləri aparmaq üçün işlənən mürəkkəb tərkibli maddə.

4. Suda həll olunmuş sement, əhəng, gil və qum qatışığından ibarət qatı maye (tikintidə yapışdırıcı maddə və mala çəkmək üçün işlədilir). *Palçıq tutmaq. Gil palçığı.* – [Rza:] *Palçıq divarların içindəki həyatimiz uzun bir dərəyə oxşayırdı.* M.İbrahimov.

◊ **Palçıq yaxmaq (atmaq)** – şər atmaq, ləkə vurmaq, böhtan atmaq.

**PALÇIQÇI** *is.* Palçıq (4-cü mənada) tutan və palçığı bənnaya verən bənna köməkçisi. *Palçıqçı Bəşir donluğunu almış, borcları ilə tutuşduraraq evə qayıdırdı.* C.Cabbarlı.

**PALÇIQÇILIQ** *is.* Palçıqçının işi, peşəsi. *Palçıqçılıqla məşğul olmaq.*

**PALÇIQLAMA** "Palçıqlamaq"dan *f.is.*

**PALÇIQLAMAQ** *f.* 1. Palçıq vurmaq, palçıq sürtmək; malalamaq. *Divarı palçıqlamaq.*

2. Palçığa bulamaq (bulaşdırmaq), palçıqlı olmaq. *Paltosunu palçıqlamaq.*

**PALÇIQLANMA** "Palçıqlanmaq"dan *f.is.*

**PALÇIQLANMAQ** 1. *məch.* Palçıq vurulmaq, palçıq sürtülmək; malalanmaq. *Divar palçıqlandı.*

2. *qayıd.* Palçığa bulanmaq. *Üst-başı palçıqlandı.*

**PALÇIQLATMA** "Palçıqlatmaq"dan *f.is.*

**PALÇIQLATMAQ** *icb.* 1. Palçıq vurdurmaq, palçıq sürtdürmək; malalatmaq. *Barını palçıqlatmaq.*

2. Palçığa bulatmaq, palçığa bulaşdırmaq.

**PALÇIQLI** *sif.* 1. Palçıq basmış, palçıqla örtülü. *Palçıqlı yer. Palçıqlı səki.* – *Polad asfaltlı küçədən çıxıb, palçıqlı bir döngəyə girdi.* S.Rəhman. *Qabaqda sürüşkən və palçıqlı kənd yolu görünürdü*. H.Seyidbəyli.

2. Palçığa batmış, palçığa bulanmış. *Palçıqlı ayaqqabı. Palçıqlı maşın.* – ..*Biçarə qardaşlarımız bir əldə süfrə və bir əlində palçıqlı başmaqları, süfrəni yerə döşüyüb başlayırlar küftə yeməyə*. C.Məmmədquluzadə. [Rüstəm] *çox gec, üst-başı palçıqlı və yorğun-arğın halda evə qayıtdı.* M.İbrahimov. // Bulanıq, lehməli. *Palçıqlı su.*

**PALÇIQLIQ** *is.* Çoxlu palçıq olan yer; zığlıq, lehməlik. *Palçıqlıqda batmaq.*

**PALÇIQTUTAN** *sif.* və *is.* Bina tikmək üçün palçıq (4-cü mənada) hazırlayan. *Palçıqtutan fəhlə.* – *Burada bənnalar, daşdaşıyanlar, palçıqtutanlar həvəslə, tər tökərək işləyirdilər.* M.İbrahimov. [Biri] *palçıqtutan, daşyonan, divartikən bənnaya, fəhləyə dua eləyir, biri papiros yandırır, biri sərin su gətirir.* Mir Cəlal.

**PALEOANTROP** *is.* [*yun.*] 250-350 min il əvvəl Avropa, Asiya və Afrikada yaşamış qədim insanlar; neandertal adamı.

**PALEÓQRAF** [*yun.*] Paleoqrafiya mütəxəssisi, qədim əlyazmaları tədqiqatçısı.

**PALEOQRÁFİYA** [*yun.* palaios və grapho] Yazı tarixini, onun qrafik formalarının inkişaf qanunauyğunluqlarını öyrənən tarixi-filoloji fənn.

**PALEOLİT** [*yun.* palaios və lithos] Daş əsrinin ən qədim dövrü. *Paleolit əsri.*

**PALEONTOLÓGİYA** [*yun.* palaios, ontos və logos] Qazıntı nəticəsində tapılan nəsli kəsilmiş ən qədim heyvan və bitkilərin tədqiqi ilə məşğul olan elm.

**PALEONTOLOJİ** "Paleontologiya"dan *sif.* *Paleontoloji tədqiqat. Paleontoloji atlas.*

**PALEONTÓLOQ** [*yun.*] Paleontologiya mütəxəssisi.

**PALEOZÁVR** [*yun.* palaios və zavros] Qazıntı nəticəsində tapılmış nəhəng kərtənkələ.

**PALEOZÓY** [*yun.* palaios və zoe] Yerin geoloji tarixində mezozoy dövründən əvvəlki dövr. *Paleozoy dövrü.*

**PALID** *is. bot.* Qoza şəklində meyvəsi olan, möhkəm oduncaqlı, iri yarpaqlı ağac. [Dər-

viş:] *Qoca baltanı götürüb, uzaqda duran palıd ağaclarının birinin böyründən əl böyüklüyü qədər ağartdı..* A.Divanbəyoğlu.

**PALIDLI** *sif.* Palıd ağacı olan, palıd ağacı bitmiş, palıd ağaclarından ibarət. [Qız dedi:] *Nəbi ilə Həcərin oylaqlarından birisi olan Şırlanbulağın yanında sıx palıdlı meşədə düşdük.* S.Rəhimov. *Meşələr görmüşəm qoca palıdlı; Hündür vələsləri verib baş-başa.* R.Rza.

**PALIDLIQ** *is.* Çoxlu palıd ağacı olan yer, palıd meşəsi. *Palıdlıqda odun doğramaq.*

**PALÍTRA** *is.* [*fr.*] 1. Rəssamın iş prosesində rəng qarışdırdığı nazik taxta parçası; sini, saxsı lövhə.

2. Rəssamın yaradıcılıq üslubuna xas olan bədii ifadə vasitələrinin məcmusu.

**PALLI-PALTARLI** bax **pal-paltarlı**. *Zərnigar xanım bu dəfə dinmədi. Elə pallı-paltarlı yerinə uzandı.* İ.Şıxlı.

**PALMA** [*lat.*] Uca, düz gövdəsinin başında yelpikvari budaqlardan ibarət tacı olan, isti ölkələrdə bitən həmişəyaşıl ağac. *Qatar, palma ağacları içərisində gizlənən stansiyanın qabağında dayandı.* M.S.Ordubadi.

**PALMALIQ** *is.* Çoxlu palma ağacı bitmiş yer.

**PAL-PALTAR** *top.* Paltar, geyim, üst-baş; paltarlar. [Muzdur] *..pal-paltarı öz tərtib və səliqəsi ilə bir-birinin üstünə dərişdirdi.* S.M.Qənizadə. *Anam pal-paltarımı səliqə ilə hazırladı.* İ.Əfəndiyev.

**PAL-PALTARLI** bax **paltarlı**. *Pal-paltarlı yatmaq.*

**PALPÁSİYA** *is.* [*lat.*] *tib.* Xəstəni müayinə etmək üsulu.

**PALTAR** *is.* Əyinə geyilən hər növ geyim; libas. *İş paltarı. Ev paltarı. Paltar tikdirmək. – Elçilər qızı təzə paltarda görəndə heyran-heyran bir-birlərinin üzünə baxdılar.* Çəmənzəminli. [Nuriyyə:] *İnstitutda oxuduğum zaman rəfiqələrim gündə bir dəst paltar geydikləri halda, mən bütün ili bir donla başa vurdum..* İ.Əfəndiyev.

**PALTARASAN, PALTARASILAN** *is.* Paltar asmaq üçün xüsusi düzəldilmiş asqı aləti. *İmran kişi papağını çıxardıb, dəmir paltarasılandan asdı.* M.Hüseyn. *Qapıların yanında .. qoz ağacından qayrılmış paltarasanlar qoyulmuşdu.* M.İbrahimov.

**PALTARBİÇƏN** *sif.* Parçadan paltar biçən. *Paltarbiçən qadın.* // *İs. mənasında.* Parçadan paltar biçən usta, dərzi.

**PALTARÇI** *sif.* və *is.* İctimai yerlərdə gələnlərin paltarını saxlamaqla məşğul olan; qarderobçu. *Paltarçı qadın. – Paltarçı qız çıxarılan paltarları yuyanlara, təmizləyənlərə və ütüləyənlərə verdi.* M.S.Ordubadi.

**PALTARKƏSDİ** *is. etn.* Nişanlı qız üçün paltarlıq gətirmək və paltar biçmək mərasimi. *Bir ildən sonra oğlan evi qız üçün paltar hazırlayıb qırmızı xonçalara qoyar və qız evinə aparardı. Bunun da adına paltarkəsdi deyərdilər.* H.Sarabski.

**PALTARLI** *sif.* Əynində paltarı olan; geyimli. [Əsgərləri] *qarşılayıb alqışlayan çox idi: cırıq çarıqlı, yırtıq paltarlı muzdurlar..* H.Nəzərli.

**PALTARLIQ** *sif.* Paltar tikmək üçün yarayan, paltar tikmək üçün ayrılmış. *Paltarlıq çit. – Rüxsarə Nənəqız üçün aldığı paltarlıq parçanı, haşiyəli yaylığı, bir cüt də yastıdaban ayaqqabını çıxartdı.* S.Rəhimov. // *İs. mənasında.* Paltar üçün parça. *5 metr paltarlıq.*

**PALTARTİKƏN** 1. *is.* Paltar tikməklə məşğul olan usta; dərzi.

2. *sif.* Paltar tikməyə məxsus. *Paltartikən maşın.*

**PALTARYUYAN** *sif.* 1. İşi paltar yumaqdan ibarət olan, paltar yumaqla məşğul olan. *Paltaryuyan qadın* [Aslanı] *səmimiyyətlə qarşılayıb oturmasını xahiş etdi.* S.Vəliyev.

2. Paltar yumağa məxsus. *Yeni növ paltaryuyan maşınlar da öz quruluşu etibarilə çox maraqlıdır.* // İs. mənasında. *Mexaniki paltaryuyan maşın. Paltaryuyanı təmir etmək. Yeni markalı paltaryuyan.*

**PALTAVA** *is.* Doşab, yağ və undan hazırlanan halva növü.

**PALTO** [*fr.*] Paltar, kostyum və s. üstündən geyilən uzun üst geyimi. *Uşaq paltosu.* – [Mehriban] *şkafdan paltosunu alıb geydi.* S.Hüseyn.

**PALTOLUQ** *is.* Palto tikmək üçün yarar, palto tikmək üçün ayrılmış. *Paltoluq drap.* // *İs. mənasında.* Palto tikmək üçün yarayan parça. *3 metr paltoluq almaq.*

**PALTUS** *is.* Qalxanbalıqlar fəsiləsindən balıq növü.

**PAMAZI** bax **bumaze**. [Ağa Kərim xan:] *..Mən heç ömrümdə azar görməmişəm, pamazı paltarım olur həmişə qalın..* N.Vəzirov.

**PAMBIQ** *is.* 1. Qozalarının içindəki liflərindən iplik hazırlanan kolşəkilli birillik cənub bitkisi, həmçinin bu bitkinin ağrəngli lifləri. *Pambıq əkini. Pambıq tədarükü. Pambıq bitkisi ən qədim mədəni bitkilərdən biridir. – Yolun hər iki tərəfində pambıq kollarının düz cərgələri uzanıb gedirdi.* Ə.Əbülhəsən. ☐ **Pambıq sovkası** *zool.* – bitkilərə (əsasən, pambıq bitkisinə) ziyan vuran zərərverici. *Pambığa ən təhlükəli ziyanvericilərdən biri pambıq sovkasıdır.* **Pambıq zavodu** – yığılmış pambığı çiyid və s.-dən təmizləyərək onu ilk emal edən müəssisə. [Qaçay:] *Pambıq zavodunda iş olduğunu eşidib, Mirzə Cəmilin hüzuruna təşrif gətirdi.* Ə.Vəliyev. **Pambıq məntəqəsi** – yığılmış pambığı qəbul edib, pambıq zavodlarına göndərən məntəqə.

2. Həmin bitkinin tibb və məişətdə işlədilən təmizlənmiş liflərdən ibarət tüklü tiftik kütləsi. *Yaraya pambıq qoymaq.*

3. Pambıq ipliyindən toxunmuş, yaxud içərisinə pambıq qoyulmuş. *Pambıq parça. Pambıq yorğan.*

**PAMBIQATAN** *is.* Xam pambığı əl, ya maşında çiyid, zir-zibil və s.-dən təmizləməklə məşğul olan adam, fəhlə. [Hacı:] *Ey Ağa Mirzə Mehdi, atanın pambıqatan olması oğluna eyib edər?* N.Vəzirov.

**PAMBIQÇI** *is.* Pambıq əkib-becərməklə məşğul olan kəndli. *Şirin .. Muğan pambıqçısı idi.* Ə.Əbülhəsən.

**PAMBIQÇILIQ** *is.* Kənd təsərrüfatının pambıq əkib-becərməklə məşğul olan sahəsi; pambıq əkib-yetişdirmə işi. *Pambıqçılığı inkişaf etdirmək. – 20-ci illərin sonu, 30-cu illərin əvvəllərində Azərbaycan torpaqları pambıqçılığın meydanına çevriləndə Xəlilgilin* [Xəlil Rzanın] *babadan qalma bağları da əllərindən alınmış, şumlanıb yerinə çiyid səpilmişdi.* B.Nəbiyev.

**PAMBIQQURUDAN** *sif.* Pambığı qurutmağa məxsus. *Pambıqqurudan meydançalar.*

**PAMBIQLI** *sif.* 1. Pambıq olan, pambıq əkilmiş. *Pambıqlı tarla. – Ağ pambıqlı geniş Muğan; Geniş çöllər bizimkidir.* Aşıq Şəmşir.

2. Pambığı olan, içərisinə pambıq qoyulmuş. *Pambıqlı yorğan.* – [Çimnaz] *pambıqlı canlığını əyninə taxıb, qızına da təzə paltarını dəyişməyi təklif etdi.* Ə.Əbülhəsən.

**PAMBIQLIQ** *is.* Pambıq əkilmiş sahə, pambıq tarlası. *Pambıqlığı becərmək. Pambıqlığı sulamaq.*

**PAMBIQTƏMİZLƏYƏN** *sif.* Yığılmış pambığı çiyid, zir-zibil və s.-dən təmizləyən. *Pambıqtəmizləyən zavod.*

**PAMBIQYIĞAN** *is.* Pambıq yığmaq, pambıq toplamaqla məşğul olan adam. [Qulu:] *Hər gün saat birdən üçə qədər pambıqyığanların istirahət saatlarıdır.* İ.Əfəndiyev. // Sif. mənasında. *Pambıqyığan qız. Pambıqyığan maşın.*

**PAMFLÉT** [*ing.* pamphlet] Hər hansı bir şəxs, yaxud ictimai quruluş, siyasi hadisə və s. əleyhinə yazılmış istehzalı publisistik əsər. *Siyasi pamfletlər. Pamfletə yaxın publisistik əsərlər. Pamflet janr kimi Renessans dövründə formalaşmışdır.*

**PAMFLETÇİ** *is.* Pamflet yazan yazıçı, pamflet müəllifi.

**PAMPA** *is.* [*isp.*] Cənubi Amerikada ot örtüyü ilə zəngin olan bəzi ərazilərə verilən ad.

**PAMPERS** *is.* [*xüs.*] Sidikhopduran.

**PAN** [*pol.* pan] Polyak, habelə 1917-ci il inqilabından əvvəl ukraynalı və belorus mülkədar; zadəgan, ağa.

**PANÁMA** [*coğr. is*-dən] 1. Yay şlyapası növü. *Ağayarın halı çox pərişandı, həmişə qaşları üstünə əydiyi həsir panaması indi peysərinə aşmışdı.* Ə.Əbülhəsən.

2. Adətən birrəngli süni ipək parça növü.

**PANDEMÍYA** [*yun.* pandemia – ümumxalq] Bütöv bir ərazini, ölkəni və s. tutan yoluxucu xəstəlik – epidemiya.

**PANDÍT** *is.* Kəşmir brahmanlarının ümumi adı.

**PÁNDUS** *is.* [*fr.*] Binalarda pilləkən əvəzinə istifadə edilən maili müstəvi.

**PANÉL** [*alm.* paneel] 1. Bina quraşdırma işlərində istifadə edilən iri dəmir-beton və ya taxta lövhə-plitə.

2. Binanın içəri divarlarının aşağısına taxtadan, dəmirdən və s.-dən vurulan haşiyə, köbə və ya çəkilən rəng.

**PANELLİ** *sif.* Panellərdən tikilmiş, panellərdən quraşdırılmış. *Panelli ev. Panelli divar.*

**PANNO** [*fr.*] 1. Divarın, tavanın şəkil, yapma ornament və s. ilə bəzədilmiş hissəsi.

2. Divarın, tavanın həmin hissəsini bəzəmək üçün şəkil, barelyef və s.

**PANORÁM(A)** [*yun.* pan – hamı və horama – görünüş] 1.Yuxarıdan işıq düşən girdə binanın divarlarında çəkilmiş iri şəkil; məkan sənəti növlərindən biri. *Panoramanın ən yaxşı nümunələri. Panorama tamaşaçıda real məkan illüziyası əmələ gətirir.*

2. Adətən yuxarıdan baxdıqda göz qabağında açılan geniş mənzərə.

◊ **Panoram filmi** – iri yarımdairəvi ekranda, yaxud tamaşaçıları hər tərəfdən əhatə edən ekranda nümayiş etdirilmək üçün xüsusi aparatlarla çəkilmiş kinoşəkil. **Panoram kinoteatrı** – panoram filmləri nümayiş etdirmək üçün xüsusi cihazlarla təchiz olunmuş kinoteatr. **Panoramlı əsər** – dolğun xarakterlərlə zəngin, müxtəlif epizodlardan ibarət əsər.

**PANSİÓN** [*fr.*] Xarici ölkələrdə və 1917-ci il inqilabından qabaq Rusiyada: qapalı təhsil-tərbiyə müəssisəsi (burada tərbiyə olanların bütün təminatı həmin müəssisənin öhdəsində olur). [Pəricahan:] *..Mən irəliki kimi şəhərə köçəcəyəm və qızımı da pansiona verəcəyəm.* S.S.Axundov. // İnqilabdan qabaq Rusiyada: bəzi orta məktəblərdə pullu ümumi yataqxana. [Faiq əfəndi:] *Əsəd, .. Qori darülmüəlliminində olan pansiona bir nəfər şagird qəbul etmək üçün verdiyimiz ərizəni oranın müdiri qəbul etmişdir.* A.Səhhət. // Yeməklə bərabər otaq verilən mehmanxana növü; pansionat.

**PANSİONÁT** [*fr.*] 1. Hər hansı bir yerdə yaşayan adamın hər şeylə təmin olunması (bəzi məktəblərdə, kurortlarda və s.-də).

2. İstirahətə gələnlərin gecələməsi üçün yer, avtomobillərinin dayanması üçün dayanacaq və s. olan mehmanxana növü. *Gölün mənzərəli sahilində mehmanxana və pansionat tikilmişdir*. (Qəzetlərdən).

**PANTEİST** [*yun.*] Panteizm tərəfdarı.

**PANTEÍZM** [*yun.* pan – hamı və theos – Allah] Allahı təbiətlə eyniləşdirən və təbiəti Allahın təcəssümü sayan dini-fəlsəfi dünyagörüşü.

**PANTEÓN** [*yun.* pan – hamı və theos – Allah] 1. Qədim yunanlarda və romalılarda: bütün allahların şərəfinə tikilmiş məbəd.

2. Hər hansı bir çoxallahlı dinin bütün allahları bir yerdə.

3. Görkəmli şəxsiyyətlərin dəfn olunduğu yer.

**PANTOKRİN** [*monq.* pynty – maral buynuzu və *yun.* krino – ayırıram] *əcz.* Maral buynuzundan hazırlanan dərman preparatı (müxtəlif xəstəliklərdə tonusu artırmaq üçün işlədilir).

**PANTOMİMA** [*yun.* pantomimos] İştirakçılarının hiss və fikirləri danışıqla yox, jest (əl-qol hərəkəti) və mimika ilə ifadə olunan teatr tamaşası. // Adətən dili bilmədikdə və ya pis bildikdə, əlavə ünsiyyət vasitəsi kimi tətbiq edilən əl-qol hərəkəti, mimika.

**PANTOPÓN** [*yun.* pan – hamı və *lat.* opium] *əcz.* Tərkibində morfi olan dərman preparatı (ağrıkəsən və yuxugətirən vasitə kimi işlədilir).

**PÁPA** [*lat.*] Roma katolik kilsəsinin başçısı. [İblis:] *Bəzən oluram bir papa! Cənnət satıram mən; İsa dirilib gəlsə də qorxar qəzəbimdən.* H.Cavid.

**PAPAQ** *is.* 1. Əsasən tüklü dəridən tikilən baş geyimi. *Buxara dərisindən papaq. Sur papaq. – Aslan zağarası getmiş papağını çıxardıb, əlindəki kağızı onun içinə qoydu..* M.Hüseyn. ..[Dadaş] *kepkasını götürüb, gümüşü papağını başına qoydu..* S.Rəhimov. // Ümumiyyətlə, hər növ baş geyimi.

2. Bir şeyi yuxarıdan örtən şey; qapaq.

◊ **Papaq eləmək** – bildirmək, xəbər eləmək. *Xeyir iş olanda bizə də bir papaq elə.* **Papağını əyri (çəp) qoymaq** – xatircəm olmaq, rahat olmaq; özünü qayğıdan, məsuliyyətdən azad hiss etmək. [Rüstəm:] *Bizim zamanda planları yerinə yetirdin, papağını çəp qoy, neyləsən, söz deyən olmayacaq*. M.İbrahimov. **Papağını əyri (çəp) qoyub gəzmək** – heç bir işlə məşğul olmamaq, boş-boş, avara-avara gəzmək. **Papağını göyə atmaq** – çox razı olmaq, çox sevinmək. [Qızyetər Nəcəfə:] *Sən papağını göyə at ki, Şirzadla gəzirəm*. M.İbrahimov. **Papağını qabağına qoymaq** yaxud **qabağına qoyub fikirləşmək** – yaxşı-yaxşı düşünmək, hər-

tərəfli düşünmək, götür-qoy etmək. [Səkinə Rüstəmə:] *Papağını qoy qabağına, ağlını yığ başına, ay kişi, Yarməmmədə, Salmana söykənən kəlləmayallaq uçar.* M.İbrahimov. **Papaq kimi qaralmaq** – uzaqdan qaraltı kimi görünmək, nəzərə gəlmək. [Pəri nənə:] *Gördüm ki, bir topa adam papaq kimi qaralır.* S.Rəhimov.

**PAPAQALDIQAÇ, PAPAQGÖTÜRDÜQAÇ** *is.* İki dəstə uşağın papaqla oynadığı bir oyun.

**PAPAQCIQ** "Papaq"dan *kiç*.

**PAPAQÇI** *is.* Papaq tikən usta, papaq tikib satan adam. *Məşədi Əhməd papaqçı idi.* S.Hüseyn. *Bakıda ümumiyyətlə peşəkarlar: xalçaçı, zərgər, papaqçı, saatsaz, minasaz, dəllək, boyaqçı və s. çox olardı.* H.Sarabski.

**PAPAQÇILIQ** *is.* Papaqçının işi, peşəsi, sənəti. *Papaqçılıq etmək. – Papaqçılığın getgedə tənəzzülü* [Məşədi Əhmədə] *dükan saxlamaq imkanı verməmişdi*. S.Hüseyn.

**PAPAQLAMA: papaqlama qar** – iri-iri parçalar şəklində yağan qar. *Sübh açılır, külək əsir, şaxta daha da qüvvətlənir, papaqlama qar arasıkəsilmədən yağırdı.* Ə.Vəliyev.

**PAPAQLAMAQ** *f.* İri-iri parçalar şəklində, lopa-lopa yağmaq (qar haqqında). *Dünəndən başlayan qalın qar papaqlayır, yer üzünü qaplayırdı.* S.Rəhimov.

**PAPAQLANMA** "Papaqlanmaq"dan *f.is.*

**PAPAQLANMAQ** *f. k.t.* Yekəlib yumşalmaq (pambıq haqqında).

**PAPAQLI** 1. *sif.* Başında papağı olan, papaq geymiş. *Papaqlı kişi. – Aslan atasının papaqlı şəklini göstərmişdi.* S.Rəhimov. // *zərf* Başında papaq olaraq, başında papaq olduğu halda. *..O biri uşaqlar* [sinifdə] *papaqlı otururdular.* Ü.Hacıbəyov.

2. B a x **başıpapaqlı**.

**PAPAQLIQ** *sif.* Papaq tikmək üçün yarar. *Papaqlıq dəri*.

**PAPAQSIZ** *sif.* Başında papaq olmayan, papaq geyməmiş, başıaçıq. *Papaqsız oğlan*. // *zərf* Başıaçıq. *Papaqsız gəzmək.*

**PAPEY** *f. köhn.* İzləmə, təqib etmə.

**PAPIŞ** *is.* [*fars.*] Adətən evdə geyilən yüngül ayaqqabı. // Ümumiyyətlə, ayaqqabı mənasında. [Fatma xanım:] *O uşaqdı?.. Xeyr, bəbədi. Ayağına papış gərək, döşünə döşlük.* N.Vəzirov.

**PAPİRÓS** [*alm*. papier – kağız] Çəkmək üçün içi tütünlə doldurulmuş kağız lüləsi (gilizi). *Papiros çəkmək. Papiros qutusu. – Mahmud dinməzcə bir papiros yandırıb, gözlərini yerə zillədi.* Y.Əzimzadə. ◻ **Papiros kağızı** – adətən papiros gilizləri hazırlamaq üçün işlədilən çox nazik şəffaf kağız növü.

**PAPİROSALIŞDIRAN** b a x **papirosyandıran**.

**PAPİROSDOLDURAN** *sif.* Papiros gilizlərinə tütün dolduran. *Papirosdolduran maşın. // İs. mənasında*. Papiros dolduran alət, cihaz.

**PAPİROSQABI** *is.* Papiros qoymaq üçün qutu; portsiqar. [Nəsir bəy] *küçə qapısında cibindən bir gümüş papirosqabı çıxarıb içindən bir papiros götürüb yandırdı.* Ə.Haqverdiyev.

**PAPİROSYANDIRAN** *is.* Papiros yandırmaq üçün alət; alışqan, papirosalışdıran. *Kolxoz sədri masanın dalından qalxdı, papirosyandıranı çıxardı..* Ə.Əbülhəsən.

**PAPİRUS** [*yun.*] 1. Tropik qamış bitkisi.

2. Həmin bitkinin, qədim misirlilərin və başqa qədim xalqların kağız kimi istifadə etdikləri yarpağı. // Bu material üzərində yazılmış qədim yazılar.

**PAPKÁ** [*rus.*] Kağız qoymaq üçün kartondan, dəridən və s.-dən qovluq. [Yaşar:] *Hər nə var – proyekt və ya başqa hesablar hamısı bu papkadadır.* C.Cabbarlı. *Bu zaman katibə papka əlində içəri girdi*. Q.İlkin.

**PAPUAS(LAR)** *cəm* Yeni Qvineyanın və Melaneziyanın bəzi başqa adalarının yerli əhalisi.

**PARA**[1] *is.* [*fars.* parə] 1. Bir parça, bir tikə, yarım, yaxud bütöv bir şeyin yarısı. // Parça, tikə. *Xəlilin anası çiyninə heybə salıb, içinə para çörək qoydu, atasına qoşub, məktəbə yola saldı.* Ə.Haqverdiyev. [Əlikram] *kəsdiyi almanın parasını Güllüyə uzatdı..* B.Bayramov. // *məc*. Obrazlı təşbehlərdə. *Qaşlarının qarası; Sənsən bağrım parası; Bir oğlan, bir qız ola; Bir güllü mağarası.* (Bayatı). *Keçilərin qarası; Layla, körpəm, a layla! Ürəyimin parası; Layla, körpəm, a layla!* R.Rza. ◻ **Bir para** – bəzi, bəzisi. *Bir para şəxslər. Bir para məsələlər. – Axır vaxtlarda Qərb*

*övrətləri barəsində müsəlman qəzetlərinin bir parasında bir neçə məqalələr gözümə sataşır.* C.Məmmədquluzadə. *..Quşların bir paraları oxumaqda, o biri paraları uçub özləri üçün yem gəzməkdə .. idilər.* A.Divanbəyoğlu.

2. Rəqəmlərdən sonra və "kənd" sözündən əvvəl işlədilir. *On dörd para kənd əhli bu məşrutə zamanı; Gər ac, susuz düşsə biyabanə, dolaşma!* Ə.Qəmküsar. [Səlimi İsfahaniyə:] *..Azərbaycan və Mazandaranda altmış para kəndiniz var, bu kəndlərin çoxunu da heç görməmişsiniz..* M.İbrahimov.

**para-para** *sif.* Parça-parça, doğram-doğram. □ **Para-para etmək (eləmək)** – parça-parça etmək, doğram-doğram etmək, tikə-tikə etmək; parçalamaq, doğramaq. *Yandıralar alovlara Zakiri; Eyləyələr para-para Zakiri.* Q.Zakir. *..Qutu pəncərə şüşəsini para-para elədi.* S.Rəhman. **Para-para olmaq** – parça-parça olmaq, doğram-doğram olmaq, tikə-tikə olmaq. [Uşaqların] *ayaqları dizlərinədək palçığa batmışdı, paltarları para-para olub, bədənləri görünürdü.* Çəmənzəminli.

**PARA**[2] *is.* Pul. *Keçən gün* [Zeynal] *səhər evdən çıxarkən vədə vermişdi ki, bu gün ən aşağısı üç yüz manat para alacaqdır.* S.Hüseyn. *Əhməd fındıq dükanını ləğv edib və ələ gətirdiyi paraları öz arxalığının astarına tikib yola düşdü.* B.Talıblı.

**PARABELLUM** [*lat.* para bellum – müharibəyə hazırlaş] Avtomat tapança növü. *Bozumtul adyalla örtülmüş taxta çarpayıların başından sarı qoburlu alman parabellumu asılmışdı.* M.Hüseyn.

**PARÁBOLA** [*yun.* parabola – yaxınlaşma] *riyaz.* Bütün nöqtələri bir nöqtədən (fokusdan) və bir düz xətdən (direktrisadan) eyni məsafədə olan qeyri-qapalı əyri.

**PARABOLİK** *sif.* [*yun.*] 1. Parabola şəklində olan. *Kometanın parabolik orbiti. Parabolik tağ.*

2. Paraboloid şəklində olan. *Parabolik güzgü.* // Parabola şəklində əyilmiş güzgüsü olan. *Parabolik teleskop.*

**PARABOLÓİD** [*yun.* parabole və lidos] *riyaz.* Bir parabolanın ucunun hərəkətsiz duran başqa parabolaya sürtünməsi nəticəsində alınan səth.

**PARÁD** [*fr.*] 1. Qoşunların təntənəli rəsm-keçidi; rəsm-keçid.

2. İdman, tələbə, gənclər və s. təşkilatların üzvlərinin təntənəli yürüşü.

3. Nümayiş. *İdman paradı.*

**PARADIRNAQ** *sif. zool.* Qoşadırnaq, haçadırnaq (*heyvan*).

**PARADÓKS** [*yun.* paradoxos – gözlənilməz, qəribə] Adi və hamı tərəfindən qəbul olunmuş fikrə, mühakiməyə, qənaətə qəti uyğun olmayan, (bəzən ancaq ilk baxışda) düzgün mühakiməyə zidd olan nöqteyinəzər, fikir. // *kit.* Elmdə adi təsəvvürlərə uyğun gəlməyən gözlənilməz hadisə.

**PARADOKSÁL** *sif.* [*yun.*] Qeyri-adi, inanılmaz, ağlasığmaz. *Lakin dünya xalqlarının tarixi müqəddəratında paradoksal hadisələr az deyil...* Ə.Məmmədxanlı.

**PARADOKSALLIQ** *is.* Qeyri-adilik, ağlasığmazlıq, inanılmazlıq.

**PARÁF** [*fr.*] Qısa imza, adının və atasının, yaxud familiyasının adının ilk hərfləri – inisial (adətən diplomatik sənədlərdə).

**PARAFİN** [*fr.*] Neftdən, habelə torf və ya boz kömürdən quru distillə yolu ilə alınan mumaoxşar ağ və ya sarımtıl maddə. // Həmin maddədən düzəldilmiş. *Parafin şam.*

**PARAFİNLƏMƏ** "Parafinləmək"dən *f.is.*

**PARAFİNLƏMƏK** *f.* Üzərinə parafin sürtmək, parafin hopdurmaq. *Çəlləyi parafinləmək.*

**PARAFİNLƏNMƏ** "Parafinlənmək"dən *f.is.*

**PARAFİNLƏNMƏK** *məch.* Parafin sürtülmək, parafin hopdurulmaq.

**PARAFİNLİ** *sif.* Tərkibində parafin olan, parafin sürtdürülmüş, parafin hopdurulmuş.

**PARAFLAMA** "Paraflamaq"dan *f.is. Paraflamanın hüquqi əhəmiyyəti.*

**PARAFLAMAQ** *f. dipl.* Beynəlxalq müqaviləni, sazişi rəsmən imzalanana qədər ilkin imzalamaq (adının, atasının adının, yaxud familiyasının ilk hərflərini yazmaqla). *Ticarət müqaviləsini paraflamaq.*

**PARAFLANMA** "Paraflanmaq"dan *f.is.*

**PARAFLANMAQ** *məch. dipl.* Rəsmi imzalanmaya qədər ilkin imza (paraf) qoyulmaq (beynəlxalq müqaviləyə). *Sülh müqaviləsi paraflandı.*

**PARAQ** *is.* Uzun qulaqları və yekə başı olan it cinsi. *Qapıya paraq; Saqqala daraq.* (Ata. sözü). *Adətdir quyruğun buduna qısar; Hər yerdə ki, görsə köpəyi paraq.* Q.Zakir. *Hələ alaçıqlara xeyli qalmış qıllı paraqlar qabağımızı kəsdi.* R.Rza.

**PARÁQRAF** [*yun.*] 1. Kitab fəslinin, məqalə mətninin müstəqil əhəmiyyəti olan və adətən "§" işarəsi və sıra nömrəsi ilə ayrılan hissəsi. *Nizamnamənin birinci paraqrafı.*

2. "§" işarəsinin özü.

**PARAQVAYLI** *is.* Paraqvayda yaşayan əhali və həmin əhaliyə mənsub olan adam.

**PARALAMA** "Paralamaq"dan *f.is.*

**PARALAMAQ** *f.* Bütöv bir şeyi para-para etmək, parçalamaq, hissələrə bölmək. *Sözün məni yaralar; Ürəyimi paralar.* M.Ə.Sabir.

**PARALANMA** "Paralanmaq"dan *f.is.*

**PARALANMAQ** *məch.* Para-para olmaq, iki yerə bölünmək, parçalanmaq.

**PARALATMA** "Paralatmaq"dan *f.is.*

**PARALATMAQ** *icb.* Parçalatmaq, iki yerə böldürmək.

**PARALÉL** [*yun.* parallelos – yanaşı gedən] 1. *sif.* b a x **müvazi**. *Paralel səth. Paralel xətt.* // *is.* Müvazi xətt. *Paralel çəkmək.* // Zərf mənasında. *Otaqda paralel qoyulmuş iki taxtdan və bucaqdakı uzun qovaq taxtalarının üstünə səliqə ilə yığılmış köhnə yorğan-döşəkdən başqa gözədəyən bir şey yox idi.* M.Hüseyn.

2. *coğr.* Ekvatora müvazi xətt. *Yer kürəsi zehnən ekvatora paralel olan müstəvilərlə kəsilə bilər. Bunun nəticəsində dairələr əmələ gəlir ki, bunlara da paralellər deyilir.* "Ümumi coğrafiya".

3. Müqayisə, tutuşdurma. *Tarixi paralellər.*

**PARALELEPÍPED** [*yun.* parallelos – paralel, epipedon – müstəvi] *riyaz.* Oturacağı paraleloqramlar olan çoxüzlü (cisim).

**PARALELÍZM** [*yun.*] 1. B a x **müvazilik**. *Xətlərin paralelizmi.*

2. Eyni işi görmə; təkrarlıq, təkrarlama, paralellik. *İdarələrin işindəki paralelizm. Paralelizmi aradan qaldırmaq.*

**PARALELLİK** b a x **paralelizm**.

**PARALELOQRÁM** [*yun.* parallelos – paralel, qram] *riyaz.* Qarşı tərəfləri bərabər və paralel olan dördbucaqlı (cisim).

**PARÁMETR** [*yun.* parametron] 1. *riyaz.* Riyazi formula daxil olan və öz sabit qiymətini yalnız həmin məsələ şəraitində saxlayan kəmiyyət.

2. *fiz. tex.* Hər hansı bir şeyin, hadisənin əsas xüsusiyyətlərini səciyyələndirən kəmiyyət və ya kəmiyyətlər. *Elektron lampasının parametri.*

**PARANÓYYA** *is.* [*yun.* paranoia – dəlilik] Sistematik sayıqlama ilə təzahür edən sabit psixi pozğunluq. *Paranoyyanın gedişi. Şizofreniyadan fərqli olaraq paranoyyada hallüsinasiyalara təsadüf olunmur.*

**PARAPÉT** [*ital.* parapetto] Bir yerin boyunca uzanıb gedən alçaq divarcıq, məhəccər.

**PARASIZ** *sif.* Pulu olmayan, pulsuz, kasıb. *Adəmi adəm eyləyən paradır; Parasız adəmin üzü qaradır!* M.Ə.Sabir. // Müftə, havayı, pulsuz. [Şah] *dillərdə söylənən hər cür ləzzətli yeməkləri bişirtdirdi, pulsuz, parasız* (z.) *gələnə, gedənə yedirtdi.* (Nağıl).

**PARASIZLIQ** *is.* Pulsuzluq. *Mehriban Zeynalın parasızlığının səbəbini bilirdi.* S.Hüseyn. *Bir yandan işsizlik, parasızlıq, .. bir yandan da sənət eşqi Həsəni rahat buraxmayıb, ruhuna əziyyət verirdi.* B.Talıblı.

**PARAŞǗT** [*fr.*] Təyyarədən və ya başqa uçucu aparatdan yerə tullanmaq, yaxud yük düşürmək üçün havada böyük bir çətir (zontik) kimi açılan alət. [Paraşütçü] *gülə-gülə paraşütü yığmağa başlayıb ona heyran-heyran baxan Kamala yaxınlaşırdı.* M.Rzaquluzadə.

**PARAŞÜTÇÜ** *is.* Paraşütizmlə məşğul olan adam. // Paraşütlə tullanan adam. *Paraşütçü əsgər.*

**PARAŞÜTÇÜLÜK** b a x **paraşütizm**.

**PARAŞÜTİZM** [*fransızcadan*] Paraşütlə tullanışın nəzəriyyə və praktikası; paraşüt idmanı.

**PARATİF** [*yun.* para və tif] *tib.* Qarın yatalağı mikroblarına yaxın olan basillərin törətdiyi keçici xəstəlik.

**PARAZÍT** [*yun.* parasitos] *biol.* 1. Başqa bir orqanizmin üzərində və ya içində yaşayıb onun hesabına qidalanan bitki və ya heyvan; tüfeyli.

2. Bit, birə, taxtabiti, gənə kimi həşərat haqqında. *Parazitlərlə mübarizə.*

3. *məc.* İstismarçı, müftəxor, başqasının əməyi hesabına yaşayan adam; tüfeyli. *Parazitin biridir.*

**PARAZİTİZM** [*yun.*] *biol.* Parazitlik, tüfeylilik, tüfeyli həyat.

**PARAZİTLİK** *is.* 1. *biol.* İki orqanizmdən birinin (parazitin) digərinin hesabına qidalanması (yaşaması); parazitizm.

2. Başqasının hesabına yaşama; tüfeylilik.

**PARAZİTOLÓGİYA** [*yun.* parasitos və logos] Parazitlər və parazitizm haqqında elm.

**PARAZİTÓLOQ** [*yun.*] Parazitologiya mütəxəssisi.

**PARÇ** *is.* Tayqulp, birəlli, qulplu su qabı. *Parçla su içmək. Bir parç su.* – [Usta Zeynal Qurbana:] ..*Get bizə, saxsı ləyən var, küpə var, onları və bir parç da götür, gəl.* C.Məmmədquluzadə. *Qızxanım .. parçı ağzına qədər ayranla doldurub, Almurad babaya verdi.* İ.Əfəndiyev.

**PARÇA**[1] *is.* 1. Parçalanmış, sındırılmış, qırılmış, cırılmış şeyin kiçik tikəsi, qırığı, hissəsi. *Kağız parçası. Odun parçası. – Buruqların dörd tərəfində dəmir və taxta parçaları gözə dəyirdi.* M.İbrahimov. *Dəstə sürüşkən daş və qaya parçalarının üzəri ilə aşağıya enməli idi.* S.Vəliyev. // Tullantı, qırıntı. *Şüşə parçaları.*

2. Bir əsərin, çıxışın müəyyən hissəsi. "*Vaqif*"*dən parça göstərmək. Musiqi parçası. – Bir nəfər artist Kərimbəyin* "*Süngü*" *adlı təzə əsərindən parça oxudu.* Mir Cəlal. *Məktəbin divar qəzetində arabir* [S.Vurğunun] *kiçik parçalarını; şeirlərini oxumuşduq.* O.Sarıvəlli.

3. "Bir" sözü ilə: **bir parça** – bir az, bir tikə, bir qırıq. *Zeynal bayaqdan bəri qabağındakı nimçədə doğramaq istədiyi bir parça əti eləcə qoyub, əlindəki bıçağı yerə buraxdı.* S.Hüseyn. *Hədiyyə bir parça çörək götürüb qəzetə bükdü.* Mir Cəlal.

**parça-parça** *zərf* və *sif.* Sınıq-sınıq, xıncım-xıncım, tikə-tikə. [Əlimuxtar:] *Arif Hikmət elə vurdu yumruğu stolun üstə ki, stolun şüşəsi parça-parça oldu.* C.Cabbarlı. *İri güzgü sıçrayıb yerə düşdü və parça-parça oldu.* S.Rəhman. // Cırıq-cırıq. *Kərbəlayı Ağcanın köynəyi parça-parça olmuşdu.* Çəmənzəminli. [Arvadın] *saçları pırtlaşıb kilkələnmiş, üstü-başı parça-parça olmuşdu.* Ə.Vəliyev. // Doğram-doğram, tikə-tikə. [Qız Məlikməmmədə:] *Ay cavan, yazıqsan, qayıt gizlən, indicə div oyanar, səni parça-parça elər.* Çəmənzəminli. [İncə:] ..*Doğru bir şey bilərsə, inan, məni parça-parça doğrayar.* C.Cabbarlı.

**PARÇA**[2] *is.* Toxunma mallar: çit, bez, mahud və s.; arşınmalı. *Ağır sandıq seçmə parçalarla dolu idi.* Mir Cəlal. *Göyçək parçanı alıb, o üz-bu üzünə baxdı.* B.Bayramov.

**PARÇABOZBAŞ** *is.* Parça ətlə kartof, noxud və s.-dən hazırlanan bozbaş növü.

**PARÇACIQ** *is.* Kiçik parça; tikəcik.

**PARÇAÇI** 1. B a x **bəzzaz**.

2. B a x **bəzzaziyyə** 2-ci mənada. [Xortdan:] *Hacının şəhərdə parçaçı dükanı var idi.* Ə.Haqverdiyev.

**PARÇADÖŞƏMƏ** *is.* Xuruşu düyünün altında bişən ət parçalarından ibarət plov növü.

**PARÇALAMA** "Parçalamaq"dan *f.is.*

**PARÇALAMAQ** *f.* 1. Parça-parça etmək, tikə-tikə doğrayıb, kəsib paralamaq; doğramaq. *Kağızı parçalamaq. – Köpək madyanın alt dodağını dartıb parçaladı.* S.S.Axundov. // Bütöv bir şeyi kəsmək, bölmək, doğramaq. *Əti parçalamaq.* // Məc. mənada. [Şamil] *uzaqdan-uzağa alman əsgərini görəndə .. birbaş irəli atılıb onu dırnaqları ilə parçalamaq istəyirdi.* M.Hüseyn. // Dişi ilə kəsik-kəsik etmək, parça-parça etmək, dağıdıb tökmək, öldürmək. *Canavar qoyunu parçalamışdı.* – [Kərim baba:] ..*Bir gün eşitdim ki, kəndin yaxınlığında pələng üç inək parçalamışdır.* A.Şaiq. // Məc. mənada. *İncə bir riqqət Rübabənin könlünü parçaladı.* Mir Cəlal.

2. Bir neçə hissəyə ayırmaq, bölmək.

3. *xüs.* Tərkib hissələrinə, elementlərinə ayırmaq. *Kimyəvi reaksiya nəticəsində suyu parçalamaq.*

**PARÇALANMA** "Parçalanmaq"dan *f.is.*

**PARÇALANMAQ** 1."Parçalamaq"dan *məch.*

2. *qayıd.* Parça-parça olmaq, tikə-tikə olmaq; sınaraq, paralanaraq bütövlüyünü itirmək, dağılmaq. *Kəklikli qayanın sinəsində iki böyük daş parçalanıb uçmuş, .. dərin oyuqlar açılmışdı.* B.Bayramov. // Məc. mənada. *Bir zülmkar dəmir qəfəs; Boğulacaq ömrüm yazıq; Parçalandı dərdli könlüm; Parçalandı sənsiz artıq.* Ə.Cavad.

3. Hissələrinə, elementlərinə ayrılmaq. *..Radium, uran və toriumun atomları öz-özünə parçalanır..*

4. Sınmaq, qırılmaq, para-para olmaq, tikə-tikə olmaq. *Fincan yerə düşüb islanmış palçıq kimi parçalandı.* Mir Cəlal. *Səməd yerə dəyib parçalanan* (f.sif.) *qədəhin cingiltisinə dönəndə qəribə bir mənzərə gördü.* İ.Hüseynov.

5. **Parçalanmış** şəklində – qarğış məqamında işlədilir. *Ay parçalanmış, harada idin?*

**PARÇA-TİKƏ** *sif.* Parça, qırıq, qalıq, xırda hissə. *Parça-tikə çörək.* // İs. mənasında. *Parça-tikədən qurama tikmək.*

**PARDAQ** *is.* [*fars.* "pərdaxt"dan] Düz səth üzərində parıltı, parlaqlıq, cila.

**PARDAQÇI** *is.* Sənəti mebel və s. pardaqlamaqdan ibarət olan, pardaqlama işi ilə məşğul olan; cilalayıcı, pardaqlayıcı (adam). *Pardaqçı usta.*

**PARDAQLAMA** "Pardaqlamaq"dan *f.is.*

**PARDAQLAMAQ** *f.* 1. Üstünü bir şeylə sürtərək parıldatmaq, hamarladıb işıldatmaq; cilalamaq.

2. Tütün yarpaqlarını ipə düzüb asmaq.

**PARDAQLANMA** "Pardaqlanmaq"dan *f.is.*

**PARDAQLANMAQ** 1. "Pardaqlamaq"dan *məch. Stollar pardaqlandı. Dəri pardaqlandı.*

2. *qayıd.* Qəşəngləşmək, gözəlləşmək, təravətlənmək, çiçək kimi açılmaq. *Pəri gül kimi pardaqlandı, yasəmən kimi çiçək açdı.* "Qurbani". [Nəcibə] *gündən-günə tənək zoğu kimi boy atır, pardaqlanır, qızılgül kimi açılırdı.* Mir Cəlal.

**PARDAQLANMIŞ** b a x **pardaqlı**. *Sən hələ bilmirdin sevgi xoş gülüş; Sevgi pardaqlanmış əyin-baş deyil.* S.Tahir.

**PARDAQLATMA** "Pardaqlatmaq"dan *f.is.*

**PARDAQLATMAQ** *icb.* Pardaqlama işi gördürmək, işıldatmaq, parıldatmaq, parıltı verdirmək, cilalatmaq. *Mebeli ustaya pardaqlatmaq.*

**PARDAQLAYICI** 1. *sif.* Pardaqlama işi görən; pardaqlayan, cilalayıcı. *Pardaqlayıcı dəzgah.*

2. B a x **pardaqçı**.

**PARDAQLI** *sif.* Üzərinə pardaq verilmiş; pardaqlanmış, cilalanmış, işıldadılmış. *Pardaqlı dəri.*

**PAREMİYA** *is.* [*yun.*] 1. Dini-əxlaqi hekayə // Hədis.

2. Kinayə, rəmz.

3. İdiomlar.

**PARÉZ** *is.* [*yun.*] Natamam iflic, bədənin müəyyən vəzifə daşıyan hissəsinin zəifləməsi. *Parez olmaq.*

**PARƏBİZƏN** *is.* [*fars.*] *zool.* Üzərində qırmızı, sarı və ya ağ xallar olan böcək; xanımböcəyi.

**PARILDADILMA** "Parıldadılmaq"dan *f.is.*

**PARILDADILMAQ** "Parıldamaq"dan *məch.*

**PARILDAMA** "Parıldamaq"dan *f.is. Günün parıldamasına baxmayaraq, maşınla pambıq yığmaq mümkün deyildi.* Ə.Vəliyev.

**PARILDAMAQ** *f.* Parıltı vermək, bərq vurmaq, parlamaq, işıldamaq. *İşıq düşər qar üstünə, parıldar; Tapdalayan vaxtda onu xarıldar.* A.Səhhət. *..Şərq buludları altun kimi parıldayır, Ay və ulduzlar sönük bir halda gözdən itirdi..* Çəmənzəminli. *Dağlar, çəmənlər geyinər al, yaşıl; Yerlər, göylər parıldar işıl-işıl.* H.Cavid. *Mavi göylərdə axşam günəşinin son işıqları parıldayır.* M.İbrahimov. // Az işıq vermək, işıq saçmaq, işarmaq, şəfəqlənmək.

◊ **Gözləri parıldamaq** – b a x **göz**.

**PARILDAŞMA** "Parıldaşmaq"dan *f.is.*

**PARILDAŞMAQ** *qarş.* 1. Bərq vurmaq, parıltı vermək (çox şey haqqında); parlaşmaq. *Pəncərələrdən içəri işıq dolur, teleqraf telləri, dəmir taxtapuşlar parıldaşırdı.* Ə.Vəliyev. *Yaşıl otlar üzərində xırdaca damcılar inci kimi parıldaşırdı.* M.Rzaquluzadə.

2. Azacıq işıq vermək, işarmaq (çox şey haqqında), işıldaşmaq, sayrışmaq. *Göydə isə ara-sıra ulduzlar parıldaşırdı.* S.Rəhimov.

**PARILDATMA** "Parıldatmaq"dan *f.is.*

**PARILDATMAQ** *f.* Bir şeyi silməklə, yaxud üzərinə bir şey sürtməklə, çəkməklə ona parıltı vermək; işıldatmaq. *Taxtanı pardaqlayıb parıldatmaq.* // İşıldatmaq, parlatmaq. *Dirəkdən asılmış iri fənərlərin işığı asfalt yolu parıldadırdı.* M.Hüseyn.

**PARIL-PARIL: parıl-parıl parlamaq** – b a x **par-par parıldamaq** ("**par-par**"da). *Hanı parıl-parıl parlayan gözlər?* S.Rüstəm. *Samovarlar parıl-parıl parlayaraq qaynayırdılar.* S.Rəhman.

**PARILTI** *is.* Qığılcım kimi saçan gözqamaşdırıcı işıq. *Qaranlıq otaqda poqonların parıltısından özünü itirən, .. tüfəng-tapançalı Ələmdardan çəkinən Alagöz udqundu.* S.Rəhimov. *..Brilyantların parıltısı qaranlıqda şəfəq saçdı.* S.Vəliyev. // Parıldayan, sayrışan işıqlı nöqtələr, parıldayan dairəciklər. *Volqa sahillərinin işıqları sayrışır; Ulduzların əbədi, sonsuz parıltısıtək!* Ə.Cəmil. // Uzaqda görünən işıqlı şey. *Gözümə bir parıltı dəydi. O parıltı nədir?*

**PARILTILI** *sif.* Parıltısı olan, parıldayan, bərq vuran. *Dağ gülünün çiçəkləri; Nanələrin ləçəkləri; Parıltılı şehlə doldu.* M.Dilbazi.

**PARİK** [*fr.*] Parçaya tikilmiş süni taxma saç. *Parik qoymaq. Teatr pariki. – Parikin ən xırda təfərrüatında da zahiri bənzəyişə xüsusi fikir verilmişdi.* M.Hüseyn.

**PARİKLİ** *sif.* Başına parik qoymuş, başında parik olan.

**PARİTÉT** *is.* [*lat.*] Bərabərlik, bərabər vəziyyət.

**PARK** [*ing.*] 1. Xiyabanları, çiçəklikləri, nohurları və s. olan böyük bağ, ağaclıq. *Mərkəzi mədəniyyət və istirahət parkı. Dənizkənarı park. – Səlim* [Mehribanı] *əski qəbiristanın yerində yeni salınmaqda olan parka apardı.* S.Hüseyn. *Şəhərin ətrafında iki park, tingliklər, parniklər yaradılırdı.* Ə.Sadıq.

2. Nəqliyyat vasitələrinin dayandığı və təmir olunduğu yer. *Trolleybus parkı. Avtobus parkı. Tramvay parka gedir.*

3. *hərb.* Müharibə zamanı ordunu döyüş sursatı, alətlər, ehtiyat hissələri və s. ilə təchiz etmək üçün səyyar anbar. *Artilleriya parkı.*

**PARKÉT** [*fr.*] 1. Hər hansı bir həndəsi şəkil formasında döşəmə salmaq üçün işlədilən kiçik hamar taxta parçaları.

2. Belə taxtacıqlardan düzəldilmiş döşəmə. [Veysəl] *nəzərlərini silinmiş parketdən ayırmadı.* B.Bayramov. // Belə taxtacıqlardan düzəldilmiş, parketlə döşənmiş. *Gülnaz parket döşəmənin üstündə yalın ayaqlarını şappıldadaraq pəncərəyə tərəf cumdu.* Q.İlkin. *Sultan ayağa qalxanda kreslonu elə qəzəblə itələdi ki, parket döşəmədə ağ qoşa cızıqlar düşdü.* İ.Hüseynov.

**PARKETÇİ** *is.* Parket ustası, parket düzən fəhlə. *Parketçilər briqadası.*

**PARLADILMA** "Parladılmaq"dan *f.is.*

**PARLADILMAQ** b a x **parıldadılmaq**.

**PARLAQ** *sif.* 1. Parıldayan, işıq verən, işıldayan, işaran, parıltılı. *Parlaq günəş. – Atabala .. parlaq şimal ulduzuna doğru yol aldılar.* Mir Cəlal. *Parlaq günün şöləsində; Gah yüyürür, gah dururdu.* N.Rəfibəyli. // İşıqlı, ziyadar. *Ancaq sol tərəfdə vağzalın çıraqları parlaq* (z.) *görünürdü.* S.M.Qənizadə. // Şəffaf və bərraq, parıldayan, bərq vuran, saf. *Parlaq şeh. Parlaq şüşə. Parlaq su.*

2. *məc.* Çox gözəl, əla, çox görkəmli, unudulmaz, əvəzsiz. *Parlaq istedad. Parlaq sima.* – [Alp Arslan:] *Burda, yox şübhə ki, Xəyyam ikidir; Biri alim, biri parlaq şair.* H.Cavid. // *məc.* Çox böyük, müvəffəqiyyətli, şanlı. *Parlaq qələbə. Parlaq nailiyyət. Vətənpərvərliyin parlaq nümunəsi.* // *məc.* Möhtəşəm, təntənəli, calallı, büsatlı. *Parlaq ziyafət.*

**PARLAQLIQ** *is.* Parlaq şeyin hal və keyfiyyəti. *Lakın parlaqlığı. Şüşənin parlaqlığı. – Gülşən belə hesab edirdi ki, göy üzündəki ulduzlara parlaqlıq verən, onları ucaldan Qəhrəmanlar kəndinin zəhmətsevər, fədakar cavanlarıdır.* Ə.Vəliyev.

**PARLAMA** "Parlamaq"dan *f.is.*

**PARLAMAQ** 1. B a x **parıldamaq**. *Vaqifin sınaqlı gözləri arvadına rast gələrək parladı.* Çəmənzəminli. *Ulduzlar da parlayır bir cüt qara gözüntək..* M.Rahim.

2. *f. məc.* Ad-san qazanmaq, nüfuz və etibar qazanmaq, adı yüksəlmək, adı çıxmaq, ad qazanmaq. *Burda Lomonosov qalxdı, parladı; Oldu kainata məşəl dühası.* M.Rahim.

**PARLAMAN** b a x **parlament**. *O, bir gün parlaman önündə durmuş; Kimsəsizlər kimi boynunu burmuş; Baxırdı qayəsiz bir izdihama.* M.Müşfiq.

**PARLÁMENT** [*fr.*] Bütünlüklə və ya qismən seçilmiş nümayəndələrdən təşkil olunmuş ali qanunverici məclis. *Parlament binası.*

**PARLAMENTARÍZM** [*fr.*] Başda parlament olan dövlət idarə sistemi.

**PARLAMENTLİ** *sif.* Parlamentarizmə əsaslanan. *Parlamentli respublika.*

**PARLATMA** "Parlatmaq"dan *f.is.*

**PARLATMAQ** b a x **parıldatmaq**. *Ey div addımlarilə yüksələn diyar; Fikrini xalqımın zövqilə parlat!* M.Müşfiq.

**PARLAYICI** *sif.* Parlaq, parlayan, parıldayan.

**PARLAYIŞ** *is.* Parlama, parıldama, işartı, işıq. *Eldən qanad aldım, şimşəkdən sürət; Günəşdən parlayış, mühitdən qüvvət.* A.Şaiq.

**PARNİK** [*rus.*] Şitil, gül, tezyetişən tərəvəz, göyərti yetişdirmək üçün üstü şüşə salınmış çərçivələrlə örtülü ləklərdən ibarət oranjereya növü; şitillik. *Parnikdə şitil yetişdirmək. Parnikdən xiyar dərmək.* – [Teymur] *atasından yadigar qalmış bağçanın bir küncündə parnik düzəldib, qışda da gül-çiçək əkirdi.* M.Hüseyn. *Şəhərin ətrafında iki park, tingliklər, parniklər yaradılırdı.* Ə.Sadıq.

**PARÓDİYA** [*yun.*] Satirik ədəbiyyatın növlərindən biri; hər hansı ədəbi cərəyanı, janrı, məşhur yazıçını, yaxud əsəri məsxərəyə qoymaq məqsədilə yazılan əsər. *Sabirin parodiyaları. Musiqi parodiyası. Parodiya yazmaq.*

**PAROXÓD** [*rus.*] Buxar mühərriki ilə hərəkətə gətirilən gəmi.

**PAROXODÇU** *is. köhn.* Paroxod sahibi.

**PARÓL** [*fr.* parole – söz] Hərbi xidmət və ya gizli təşkilatlarda öz adamlarını tanımaq üçün işlədilən məxfi, şərti söz və ya ifadə. – *Dayan! – Özgə deyil; – Söylə parolu!* M.Rahim.

**PAROVÓZ** [*rus.*] Dəmir yolunda qatarları çəkib aparmaq üçün buxar mühərrikli lokomotiv. *Parovoz deposu. Parovoz tüstüsü.* – *Yalnız parovozun fiti eşidilirdi.* M.Hüseyn.

**PAROVOZÇU** *is.* Parovozu sürən, parovoza xidmət edən dəmiryolçu.

**PAR-PAR: par-par parıldamaq** – gözləri qamaşdıracaq dərəcədə parıldamaq. *Pəncərələr par-par parıldayır. Stolun üstü par-par parıldayır.*

**PART** *təql.* Partlayan, yaxud atılan və yaxud da yerə düşən ağır bir şeydən çıxan səs.

**PARTAPART** *is.* Çoxlu silahdan atəş açılarkən çıxan səs. *Göydən dolu kimi top gülləsi tökülür, partapartdan qulaq tutulur.* Ə.Əbülhəsən.

**PARTER** [*fr.*] Tamaşa zalının tamaşaçılar üçün yerləri olan aşağı mərtəbəsi. *Parterə bilet almaq. Parterin 3-cü sırası.*

**PARTILDAQ** *is.* Ağacdan, qamışdan, kağızdan və s.-dən düzəldilmiş tapança kimi səslənən uşaq oyuncağı.

**PARTILDAMA** "Partıldamaq"dan *f.is.*

**PARTILDAMAQ** *f.* Partıltı səsi çıxarmaq; partlamaq, part-part eləmək.

**PARTILTI** *is.* 1. Partlayış səsi, partlayan şeyin çıxardığı səs, partlayışa bənzər səs. *Ağayarın balkonunda yüngül bir partıltı eşidildi.* Ə.Əbülhəsən.

2. Hay-küy, dava-dalaş, qarğaşalıq. *Bir partıltı qopdu ki...* – [Ədil bəy:] *Bu partıltını, gurultunu eşitmirsiniz!* S.S.Axundov.

**PARTİTURA** [*ital.*] Çoxsəsli musiqi əsərinin bütün partiyalarının (3-cü mənada) məcmusu. *Operanın partiturası.* // Belə əsərin bütün partiyalarının yazıldığı not dəftəri.

**PARTİYA** [*fr.*] 1. Bir sinfin, siyasi təşkilat şəklində birləşmiş, öz sinfi mənafeyini ifadə və başqa siniflərlə mübarizəsinə rəhbərlik edən hissəsi. *Siyasi partiyalar.*

2. Adətən böyük miqdarda olan şey, mal və s. *Bir partiya mal. Yükləri partiyalarla göndərmək.*

3. Çoxsəsli musiqi əsərinin bir oxuyan və ya bir alət tərəfindən ifa olunan hissəsi. "*Koroğlu*" *operasından Nigarın partiyası. Skripka partiyası. – Partiya – musiqi ansamblında* (*orkestrdə, xorda, opera əsərlərində, trioda və s.*) *iştirak edənlərdən hər biri üçün yazılmış musiqidir.* Ə.Bədəlbəyli. // Belə hissənin notları. // Operada solo rolu.

4. Əvvəldən axıra qədər şahmat, kart və s. oyunu. *Bir partiya oynamaq. Üçüncü partiyanı udmaq. Dama partiyası.*

**PARTİZAN** [*fr.*] Düşmən arxasında müstəqil hərəkət edən silahlı xalq dəstələrinin iştirakçısı. *Partizanlar tez-tez yerlərini dəyişir, hər gün də təzə bir üsul işlədirdilər.* M.Hüseyn.

**PARTİZANÇILIQ** *is.* 1. Qeyri-mütəşəkkil, intizamsız, özbaşına hərəkət, özbaşınalıq. □ **Partizançılıq etmək** – bir işi özbaşına etmək, bir işi özbaşına görmək, heç kəslə hesablaşmayaraq, intizam gözləmədən hərəkət etmək.

2. B a x **partizanlıq** 1-ci mənada.

**PARTİZANLIQ** *is.* 1. Partizan mübarizəsində, partizan dəstəsində iştirak etmə; partizan hərəkatı, partizan mübarizəsi. □ **Partizanlıq etmək** – partizan mübarizəsi aparmaq, partizan dəstəsində iştirak etmək, partizan olmaq.

2. B a x **partizançılıq** 1-ci mənada.

**PARTLADICI** *sif.* Partlatmaq işi ilə məşğul olan, partlatmaq üçün olan. *Partladıcı maddə. Partladıcı qurğu.*

**PARTLADILMA** "Partladılmaq"dan *f.is.*

**PARTLADILMAQ** "Partlatmaq"dan *məch. Partladılmış* (f.sif.) *bomba. – Surxay partladılacaq qayaya göz gəzdirdi. Dinamit qoydurdu.* M.İbrahimov.

**PARTLAQ** *sif.* Partlamış halda olan; partlamış.

**PARTLAMA** "Partlamaq"dan *f.is.*

**PARTLAMAQ** *f.* 1. Partlama nəticəsində hissələrə ayrılmaq, parçalanmaq, xıncım-xıncım olmaq, qəlpələnmək. *Bomba partladı. Körpü minadan partladı. – Səfər və Tanrıverdi .. başlarını aşağı dikərək baxırkən quyu içində partlayan qazın gurultusundan diksinib çəkildilər.* A.Şaiq. *..Cəlalgilin yurdunda mina partladı..* S.Vəliyev.

2. Açılmaq (silah haqqında). *Tapança partlar, Əşrəfin sol qolu yaralanar.* H.Cavid. *Bu mükalimə arasında Kəyan lap qulağının dibində bir neçə güllə partladığını eşitdi.* Ə.Əbülhəsən.

3. Deşilmək, cırılmaq (içi hava ilə dolu və ya boş şeylər haqqında). *Futbol topu partladı.* – [Tahir:] *Maşınımın təkərinin kamerası partlamışdı, dəyişdirib təzəsini taxanacan şər qarışdı.* M.Hüseyn.

4. Çatlamaq, üzərində çatlaqlar əmələ gəlmək, cadar-cadar olmaq, parçalanmaq (bir şeyin qabığı, səthi, üzü). *..Ağaclarda partlamış* (f.sif.) *narların hər dənəsi .. qızarıb şəfəq verirdi.* Çəmənzəminli. *Dodaq cadar-cadar olub partlayırdı.* S.Rəhimov.

5. *məc.* Adətən "hirsindən", "acığından" və s. sözlərlə – bərk hirslənmək, coşmaq, acıqlanmaq, qəzəblənmək. *Sarı Musa acığından partlayırdı.* A.Şaiq. *Bünyad Xəlilov qəzəbindən partlamaq dərəcəsinə gəldi.* M.Hüseyn. // *məc.* Parçalanmaq (ürək haqqında). [Alı:] *Bu qara xəbərdən partlayır ürək; Getmir boğazımdan nə su, nə çörək.* S.Rüstəm. // *məc.* Hirsindən özünü saxlaya bilməyib demək. *Cavan gəlin partlayıb bir sual verdi..* S.Rəhimov. *Səlminaz arvad böyürdən partladı..* M.Hüseyn.

6. *məc. dan.* Paxıllıq etmək, dargözlük etmək, gözü götürməmək, acıq çəkmək. [Rüstəm:] *Camaatımız dargözdür, biri irəli gedəndə partlayırlar, ağızlarına nə gəldi deyirlər.* M.İbrahimov.

**PARTLATMA** "Partlatmaq"dan *f.is.* [Daşlar] *kanal qazılarkən aparılan partlatma işlərinin nəticəsidir..* M.İbrahimov.

**PARTLATMAQ** *f.* 1. Partlayış nəticəsində dağıtmaq, parçalamaq. *Dağı partlatmaq.* – [Firəngiz:] *Qabağı kəsən, mane olan sal qayaları necə də partladıb dərəyə endirirlər.* B.Bayramov. // Partlayış əmələ gətirib dağıtmaq, məhv etmək. *Düşmən gəmisini partlatmaq. Elektrik stansiyasını partlatmaq.*

2. *məc.* Güllə ilə vurub öldürmək. [Sərvər:] *Qol qoy, yoxsa partladaram səni!* Ü.Hacıbəyov.

3. Partlamasına səbəb olmaq (şin və s. haqqında). *Şini partlatmaq. Voleybol topunu partlatmaq.*

4. Yarıq-yarıq etmək, üzərində dərin çatlar əmələ gətirmək; çatlatmaq. *Şaxta dərisini partlatdı. Yağış narları partlatdı.* // *məc.* Daxili əzab vermək, incitmək, üzüntü vermək (adətən "ürəyini", "başını" sözləri ilə). *Haqsızlıq adamı partladır.* – [İncə:] *Dursun dayı, anlat ki, mən müqəssir deyiləm, mənim ürəyimi partlatmasınlar.* C.Cabbarlı. *Beynimdəki qara fikirlər başımı partlatmaq istəyirdi.* H.Nəzərli.

**PARTLAYAN** *sif.* 1. B a x **partlayıcı**.

2. Partlayış nəticəsində tələffüz olunan (b a x **partlayış** 3-cü mənada). *Partlayan samitlər.*

**PARTLAYICI** *sif.* Partlayan, partladıcı. *Partlayıcı maddələr.*

**PARTLAYIŞ** *is.* 1. Partlama işi; partlama. *Mərminin partlayışı. Bomba partlayışı.* – [Əmrahov:] *Bənd quranlar bu günlərdə partlayış* [işləri] *aparacaqlar.* Q.İlkin.

2. *fəls.* Hər hansı bir hadisənin, antaqonistik ziddiyyət əsasında köhnə keyfiyyətdən yeni keyfiyyətə sıçrayışvari keçməsi formalarından biri.

3. *dilç.* Səsləri tələffüz edərkən qapanmış nitq üzvlərinin aralanması nəticəsində hava axınının ani olaraq çıxması.

4. *məc.* Baş vermə, həyata keçmə; olma. *İnqilabi partlayış.*

**PARTLAYIŞLI** b a x **partlayan**.

**PARTNYOR** *is.* [*fr.*] Çeşidli sahələrdə bir-birilə qarşılıqlı əlaqədə olanların hər biri; tərəf müqabili.

**PÁRUSİN** [*rus.* парусина – yelkənlik parça] Kobud bərk kətan parça növü. // Həmin parçadan tikilmiş. *Parusin şalvar*. – *Hər iki divar uzunu ağ parusin örtüklü stullar düzülmüşdü*. M.Hüseyn. [Oğlanın] *əynində ütülənmiş ağ parusin paltar .. var idi*. İ.Əfəndiyev.

**PAS¹** *is.* 1. Havada və suda oksidləşmə nəticəsində dəmirin üzərində əmələ gələn qırmızı-qonur nazik təbəqə; paxır, cəng. *Adətən üst-başı dəmir pası və yağdan çirklənmiş, paltarları yamaqlı olan fəhlələr yavaş-yavaş işə başlayır..* M.İbrahimov. ☐ **Pas atmaq (basmaq, tutmaq)** – b a x **paslanmaq**. *..Rəflərdə pas basmış .. qablar üst-üstə yığılmışdı.* Çəmənzəminli. *Bu nizələr, bu süngülər muzeylərdə pas tutacaq*. S.Vurğun. **Pas yemək** – pasdan xarab olmaq, yeyilmək (metal şeylər haqqında). *..Dəmir civləri, mıxları pas yeyib naziltmişdi*. B.Bayramov. // *məc.* Obrazlı təşbehlərdə. *Gözüm gördü, gönlüm qəmdən ayıldı; Şikəstə könlümün pası silindi*. Aşıq Ələsgər. *Çəkərəm hər zaman yası; Silinməz könlümün pası*. Aşıq Kərəm.

2. *xüs*. Bitkinin (əsasən yarpaq və gövdəsinin) üzərində tüfeyli göbələklər olan yerdə əmələ gələn sarı-narıncı rəngli ləkə.

3. *məc.* Eyib, nöqsan, ləkə. ☐ **Pası (pasının üstü) açılmaq** – eybi, nöqsanı, gizli işləri aşkara çıxmaq, faş edilmək, ifşa olunmaq. **Pasını (pasının üstünü) açmaq** – eybini, nöqsanını, gizli işlərini açıb demək, faş etmək, aşkara çıxarmaq. *Mənə qohum oldu bu cür biədəb; Varımı korladı, pasımı açdı*. M.S.Ordubadi.

4. "Bir" sözü ilə – bir müddət, bir vaxt. *..Alı kişi ilxını çölə aparar, bütün günü otarar, gecədən də bir pas keçəndən sonra xalxala gətirərdi*. "Koroğlu". *İlyas gecədən bir pas keçirdib, durub getməkdə olsun*. (Nağıl).

**PAS²** *is.* [*fr.*] Oyunda növbəni buraxmaq ("məndən keçdi" mənasında).

**PAS³** *is.* [*ing.*] Topu bir-birinə ötürmə.

**PASÁJ** [*fr.*] Hər iki tərəfində dükanlar olan örtülü qalereya. *Kitab pasajı*. – [Oğlan] *bir gün şəhərin ən məşhur pasajının anbarında olan meyxana qarşısında durub ov arayırdı*. A.Şaiq.

**PASAQ** *is. dan.* Çirk, kir, his. *Pasağını yumaq*.

**PASAQLI** *sif. dan.* Çirkli, kirli, hisli. *Pasaqlı paltar*.

**PASXA** [*qəd. yəh.* pesah – keçmə] 1. Xristianlığın əfsanəvi banisi sayılan İsanın "dirilməsinə" həsr olunmuş xristian yaz bayramı.

2. Xristianlarda həmin bayram münasibətilə bişirilən dördüzlü kiçik piramida şəklində kəsmikli şirin yemək.

**PASİBAN** *is.* [*fars.*] *klas.* 1. Qarovulçu, qoruyucu, keşikçi, nəzarətçi. *Vardı Bozlar adında bir köpəyi; Qoyunun pasibanı, həm köməyi.* S.Ə.Şirvani. *Bağçanın və sarayın ətrafında dolaşan pasibanların səslərindən başqa bir səs yox idi.* M.S.Ordubadi.

2. *məc.* Hami, himayəçi. *Əxlaqı pozğun, adəti pis, pasibanı yox; Qəlbim yanar, ona deyərəm: "Ay yazıq çocuq!"* A.Səhhət. [Bəhram Pəriyə:] *Yox, yenə səhv edirsiniz, mən xidmətçi deyiləm, mən əmim qızının pasibanıyam*. C.Cabbarlı.

**PASİBANLIQ** *is. köhn.* 1. Pasibanın işi, vəzifəsi; qarovulçuluq. *Şəhər yatmışdı. Təkbir şəhər pasibanlığı edən xoruzlar bir-birlərinə oyaq olduqlarını xəbər verirdilər.* Ə.Haqverdiyev.

2. Himayəçilik, hamilik.

**PASİBANSIZ** *sif. köhn.* Pasibanı olmayan (b a x **pasiban**). *Üç nəfər fələkzədə pasibansız dünya üzündə qaldı.* C.Cabbarlı.

**PASİFİST** [*lat.*] Pasifizm tərəfdarı.

**PASİFÍZM** [*lat.* pacificus – sakitləşdirən] Hər cür müharibəni, o cümlədən milli azadlıq, inqilabi və b. ədalətli müharibələri inkar edən və əbədi sülhü kapitalizm münasibətlərinin mövcudiyyəti ilə bağlayan siyasi cərəyan.

**PÁSKVİL** *is.* [*alm.*] Təhqiredici, böhtançı əsər.

**PASLANDIRMA** "Paslandırmaq"dan *f.is.*

**PASLANDIRMAQ** *f.* Bir şeyin pas atmasına, paslanmasına səbəb olmaq. *Yağış dəmiri paslandırdı*.

**PASLANMA** "Paslanmaq"dan *f.is.*

**PASLANMAQ** *f.* Dəmir şeylərin üzərində pas əmələ gəlmək. [Ümid] *açıq havada pas-*

*lanmağa başlayan bir "Universal"a yaxınlaşıb baxdı.* B.Bayramov.

**PASLANMIŞ** *f.sif.* Pas atmış, üstünü pas basmış, pasla örtülmüş; paslı. *Paslanmış qıfıl. Paslanmış bıçaq. – O gündən şair ilə Afaq bağçalarını paslanmış nizə, qalxan və qılınc parçalarından təmizlədilər..* Ə.Məmmədxanlı.

**PASLATMA** "Paslatmaq"dan *f.is.*

**PASLATMAQ** b a x **paslandırmaq**.

**PASLI** *sif.* Pası olan, pas atmış; paxırlı, cəngli. *Paslı qazan. – Tez-gec qırılacaq paslı zəncirlər; Al geyib doğacaq azad bir səhər.* S.Vurğun. [Otaqda] *ağzından yumruq irilikdə paslı qıfıl asılmış sandıq, sandığın üstündə bir cüt qara xrom çəkmə .. vardı.* İ.Hüseynov. // Məc. mənada. *Əntiqənin səsi .. zülmət gecədə axan ulduz kimi paslı qəlblərə nur səpib tez ötər, təkrar olunmazdı.* Mir Cəlal.

**PASLILIQ** *is.* Paslı şeyin hal və keyfiyyəti.

**PÁSPORT** [*fr.*] 1. Sahibinin şəxsiyyətini və vətəndaşlığını təsdiq edən sənəd. *Xarici pasport.*

2. Hər hansı bir maşın, avadanlıq, qurğu, təsərrüfat aləti və s. haqqında əsas məlumatlar yazılmış qeyd şəhadətnaməsi. *Avtomaşının pasportu. Dəzgahın pasportu. Televizorun pasportu.*

**PASPORTÇU** *is.* Pasportları qeyd edən işçi. *Pasportçunun qəbul saatları. Pasportu pasportçuya vermək.*

**PASPORTLAŞDIRILMA** *f.is.* Pasport sistemi tətbiq edilmə, pasport verilmə, bir şey üçün pasport tərtib edilmə. *Əhalinin pasportlaşdırılması. Avadanlığın pasportlaşdırılması.*

**PASSÁT** *is.* [*alm.*] Şimal və cənub yarımkürələrində tropiklər və ekvator arasındakı sahələrdə əsən daimi şimal-şərq küləyi. *Passatlar avropalılara hələ Kolumbun birinci ekspedisiyasından məlum idi.*

**PASSİV¹** [*lat.* passivus – fəaliyyətsiz] *mal.* Müəssisənin borc və təəhhüdlərinin məcmusu (*aktiv²* əksi).

**PASSİV²** [*lat.*] 1. *sif.* Qeyri-fəal, laqeyd. *Passiv münasibət. Passiv mübarizə. Passiv rol. Passiv müşahidə.*

2. *qram.* Feilin məchul forması.

◊ **Passiv seçki hüququ** – vətəndaşların nümayəndəli dövlət orqanlarına seçilmək hüququ.

**PASSİVLƏŞMƏ** "Passivləşmək"dən *f.is.*

**PASSİVLƏŞMƏK** *f.* Passiv olmaq, fəaliyyətsizləşmək, getdikcə fəaliyyətsiz olmaq, fəaliyyətdən düşmək.

**PASSİVLİK** *is.* Fəaliyyətsizlik, laqeydlik, hərəkətsizlik. [Həsən] *nöqsanları boynuna alır, üzvlərin kömək etmədiyindən, passivliyindən şikayətlənir.* Mir Cəlal.

**PÁSTA** [*ital.*] Kosmetikada, kulinariyada, təbabətdə və s.-də işlədilən müxtəlif xəmirəoxşar özlü maddələrin adı. *Diş pastası. Tomat pastası. – Xəlil .. əvvəlcə hazırladığı konfet, meyvə və pastaları masanın üzərinə düzdü.* Çəmənzəminli.

**PASTÉL** *is.* [*fr.*] 1. Boya, tabaşir və birləşdirici maddədən düzəldilən müxtəlif rəngli yumşaq qələmlər.

2. Bu qələmlərlə yaradılan sənət əsərləri.

**PASTERİZƏ** [fransız bakterioloqu Lui Pasterin adından] Yeyinti məhsullarının 100 dərəcədən yuxarı olmamaq şərtilə qızdırılması (bu halda zərərli mikroorqanizmlər məhv olur, ancaq məhsulun dadı, vitaminlər və s. saxlanılır). ☐ **Pasterizə edilmək (olunmaq)** – yuxarıdakı üsul tətbiq edilmək. *Xiyarın pasterizə edilməsi. Südün pasterizə olunması.* **Pasterizə olunmuş** – həmin üsuldan keçirilmiş. *Pasterizə olunmuş xiyar.*

**PÁSTOR** [*alm.* Pastor, əsli *lat.*] Protestant keşişi.

**PASTORÁL** [*fr.* pastorale; *lat.* pastoralis – çobansayağı] 1. XIV-XVIII əsrlər Avropa ədəbiyyatında və incəsənətində çobanların təbiət ağuşunda həyatını idillik şəkildə təsvir edən janr, habelə həmin janrda əsər. *Renessans dövründə Qərbi Avropada zəngin pastoral ədəbiyyatı yaranmışdı.*

2. *sif.* Həmin janrda olan. *Pastoral roman. Pastoral sonata.*

**PAŞA** *is. köhn.* Keçmiş sultan Türkiyəsində, Misirdə və bəzi başqa müsəlman Şərq ölkələrində ali əsgəri vəzifə tutan şəxslərə və mülki məmurlara verilən fəxri ünvan, titul və belə titulu olan şəxs. *Hələb paşasının adamları içəri girib, Qəribi tutub apardılar..* "Aşıq Qərib". *Aslan paşa car çəkdirib bütün camaatı meydana yığmışdı.* "Koroğlu". [Kəblə Gülü:] *Nökərinin adı Kəblə Gülüdür, paşa!* H.Nəzərli.

**PAŞTÉT** [*alm.*] Ovulub pasta halına salınmış ət, balıq və s.-dən ibarət yemək.

**PAT** [*fr.*] Şahmat oyununda: növbəti gediş zamanı şahı zərbə altına qoymaq təhlükəsinin əmələ gəldiyi və oyunun heç-heçə qurtardığı vəziyyət.

**PATAVA** *məh.* b a x **dolaq** 1-ci mənada. [Musa] *yoğun baldırlarına boz patava dolaq, iri ayaqlarına qıvrıq çarıq geyərdi.* B.Bayramov.

**PATAVALI** b a x **dolaqlı**. *Malik motal papaqlı, patavalı .. kəndliləri uzaqdan süzüb, qeyri-adi həyəcan içində olduqlarını anladı.* M.İbrahimov.

**PATEFÓN** [fransız firmasının adı Pate və *yun.* fon] Xüsusi vallara yazılmış səsi təkrarlayan musiqi cihazı. [Firuzə] *..quş kimi yüngül bir hərəkətlə qalxıb, balaca yeşiyin üstündəki patefona bir val qoydu.* İ.Əfəndiyev.

**PATÉNT** [*lat.* patentis – açıq, aydın] 1. İxtiraçının ixtirasını təsdiq edən şəhadətnamə, sənəd.

2. Alver, sənət və s. ilə məşğul olmaq hüququ verən şəhadətnamə. // Hər hansı hüququ, səlahiyyəti və s.-ni təsdiq edən şəhadətnamə. *Konsul patenti* (konsulun səlahiyyətini təsdiq edən sənəd). *Gəmi patenti* (gəminin bayrağını, mənsubiyyətini təsdiq edən sənəd).

**PATENTLƏMƏ** "Patentləmək"dən *f.is.*

**PATENTLƏMƏK** *f.* Bir iş haqqında patent vermək və ya patent almaq, onu patentlə birisinə aid etmək. *İxtiranı patentləmək.*

**PATENTLİ** *sif.* Patenti olan. *Patentli dərmanlar*.

**PATENTSİZ** *sif.* Patenti olmayan, patentlə birisinə aid edilməmiş. // *Zərf mənasında*. Patenti olmadan.

**PATILTI** b a x **tappıltı**. [Azad] *koridorda ayaq patıltısı eşidincə tez ayağa qalxıb qapı tərəfə gedir*. A.Şaiq.

**PATİSSÓN** *is.* [*fr.*] Ağ qabaq növlərindən biri.

**PÁTKA** [*rus.*] Tam şəkərləşməmiş nişastadan ibarət şirin qatı maddə. *Çuğundur patkası.*

**PATOGENEZ** *is.* [*yun.*] İnsan və heyvan orqanizmlərindəki xəstəlik proseslərinin gedişində ardıcıllıq.

**PATOLÓGİYA** [*yun.* pathos – xəstəlik və logos – elm] 1. İnsan və heyvan orqanizmlərindəki xəstəlik proseslərini və onların halını öyrənən elm.

2. *məc. kit.* Normadan kənara çıxma, qeyri-normallıq.

**PATOLOJİ** *sif.* [*yun.*] 1. Patologiyaya aid olan, patologiya ilə əlaqədar olan. *Patoloji anatomiya. Patoloji fiziologiya.*

2. *məc. kit.* Qeyri-normal, normadankənar, xəstə. *Patoloji hadisə.*

**PATÓLOQ** [*yun.*] Patologiya mütəxəssisi.

**PATRİÁRX** [*yun.* patriarches] 1. Qəbilə cəmiyyətində qəbilə başçısı.

2. Bir ölkədəki pravoslav kilsəsinin yüksək ruhani rütbəsi və bu rütbəni daşıyan şəxs.

**PATRİARXÁT** [*yun.*] 1. B a x **pədərşahlıq**.

2. Patriarxın idarəsi altında olan kilsə.

**PATRİARXLIQ** *is.* Patriarxın vəzifəsi, işi; patriarx titulu.

**PATRÓN** [*fr.*] 1. Odlu silahlarda, əsasən tüfəng və tapançada atmaq üçün barıt, qırma və ya güllə ilə doldurulmuş pistonlu (kapsullu) metal, ya karton tağalaq (giliz). [Şərifzadə] *keşikçidən aldığı silahla müqavimət göstərməyə başlayanda tələsdi, patronları tez atıb qurtardı.* M.Hüseyn. [Yoldaşım:] *İki-üç yüz patronu elə bircə gündə atarsan.* M.Rzaquluzadə.

2. *xüs*. Müxtəlif qurğularda, cihazlarda lüləşəkilli, içiboş borucuq.

**PATRONAJ** *is.* [*fr.*] Ev şəraitində müalicə; profilaktik idarələrlə yanaşı, uşağın inkişafına və tərbiyəsinə nəzarət etmə.

**PATRONDÁŞ** [*alm.* patrontasche] Tüfəng və tapança patronlarını qoymaq üçün yuvacıqları (gözləri) olan kəmər. [İmamverdi:] *A kişi, patrondaş hanı? Yalandan küyə basmışdım.* C.Cabbarlı. *Fərman evə girdi, tüfəngini, patrondaşını çıxardıb, divardakı mıxdan asdı.* Ə.Abasov.

**PATRONLAMA** "Patronlamaq"dan *f.is.*

**PATRONLAMAQ** *f.* Silaha patron qoymaq; tüfəngi, ya tapançanı doldurmaq.

**PATRONLU** *sif.* Patronu olan, patron qoyulmuş; dolu. *Patronlu tüfəng*.

**PATRONSUZ** *sif.* Patronu olmayan, patron qoyulmamış; boş. *Patronsuz tüfəng*.

**PATRÚL** [*fr.*] Müəyyən bir rayonun təhlükəsizliyinə, nizam və qaydasına nəzarət etmək üçün ayrılmış əsgər, milis və s.-dən ibarət kiçik silahlı dəstə və ya hərbi gəmi, təyyarə. *Patrul dəstəsi. Patrul təyyarəsi. – Bu müddətdə patrul gəmiləri yenə də hər dəqiqə onların qabağını kəsə bilərdi.* Q.İlkin. // Həmin dəstədə olan adam. *Patrullar sənədləri yoxlayırlar. – Patrul qəzəbli bir pıçıltı ilə xəbər aldı: – Bu partizan qəzetini sən satmısan?* S.Vəliyev.

**PÁUZA** [*yun.* pausis – kəsilmə] 1. Danışıq zamanı müvəqqəti dayanma, fasilə, ara vermə.

2. Musiqidə: ritm cəhətdən tənzim edilən fasilə. *Musiqi əsərlərinin ifası zamanı işlədilən fasiləyə* (*tənəffüsə*) *pauza deyilir.* "İbtidai musiqi nəzəriyyəsi". // Həmin fasiləni notda göstərmək üçün işarə.

**PAVİLYÓN** [*fr.*] Bağlarda, parklarda və s.-də hər hansı bir məqsəd üçün tikilən kiçik yüngül tikili. *Su pavilyonu. Gül pavilyonu. – Mağaza və pavilyonların al-əlvan titrək illüminasiyası, bəzəkli vitrinlər adamsız çox qüssəli görünürdü.* Q.İlkin. // Sərgidə eksponatları yerləşdirmək və nümayiş etdirmək üçün müvəqqəti və ya daimi bina. *Pavilyona gələnlər sərgi haqqında çoxlu yaxşı və səmimi sözlər deyirlər.* // Kino, foto şəkilləri çəkmək üçün xüsusi avadanlığı olan bina, habelə filmin ayrı-ayrı səhnələrini çəkmək üçün kinostudiya binasındakı dekorasiya. *Filmin pavilyonda çəkilmiş kadrları.*

**PAY**[1] *is.* 1. Bir neçə adam arasında bölünən şeydən hər birinə düşən hissə. [Heydər bəy:] *Yoldaşlarım da bu səfər paylarını mənə verdilər.* M.F.Axundzadə. // Eyni mənada xörək haqqında. [Nuriyyə:] [Ələsgərgili] *nə bişirsəydilər payımı saxlardılar.* İ.Əfəndiyev. ☐ **Pay çəkmək** – hər bir adam üçün xörək çəkmək. *Səlimnaz arvad oğluna və Rəşidə pay çəkib gətirəndə onları bayaq oturduqları yerdə tapmadı.* M.Hüseyn. *Xüsusi tikələrdən seçib Firəngizin payını çəkəndən sonra hərə öz qabını doldurdu.* B.Bayramov. // Bir şeyin bölündüyü hissələrdən hər biri. *Gecədən iki pay keçəndə dalandar pəlvanlarınan girib Ceyranın otağına gördülər ki, Ceyrannan Zərqova xanım yatıblar.* (Nağıl). // Miras qalmış əmlakdan hər bir vərəsəyə çatan hissə. [Gülsəba:] *Xanım, qardaşın arvadının məgər irsdə payı yoxdur?* M.F.Axundzadə. [Hüseyn:] *Qardaşdırlar, iki pay onlara düşər, bir pay mənə.* S.Rəhman.

2. Dəfə, kərə. [Məşədi İbad:] *..İndiki ahıllar indiki cahıllardan min pay yaxşıdırlar.* Ü.Hacıbəyov. [Rəsul:] *Belə gün, belə əziyyət çəkməkdənsə, bir yol ölüb qurtarmaq min pay yaxşıdır.* N.Vəzirov.

3. Hədiyyə, bəxşiş, sovqat. *..Qızın cehizində samovar yoxsa, əqrəbalardan samovar alıb pay gətirərlər.* R.Əfəndiyev. ☐ **Payın (payınız) çox (artıq) olsun!** – pay (bəxşiş, hədiyyə) verənə təşəkkür ifadəsi. *Payın çox olsun, çox sağ ol!* – [Çiçək Ümidə:] *Payın çox olsun, bala, ömrün uzun olsun!* B.Bayramov.

4. *məc.* Bəxt, tale, qismət, nəsib. ☐ **Payına düşmək (çıxmaq)** – qisməti olmaq, bəxtinə çıxmaq. *Bizim payımıza düşmüş əzəldən; Qayğısını çəkmək olur-olmazın.* M.Müşfiq.

5. *məc.* Əvəz, qarşılıq. ☐ **Payını almaq** *məc.* – əvəzini almaq, cəzalanmaq. [Rüstəm Pərişana:] *Danışar, payını da alar!* M.İbrahimov.

6. Ümumi bir işə ayrı-ayrı iştirakçılar tərəfindən verilən, yaxud birinin hissəsinə düşən pul və s. miqdarı. *Kooperativ payı. Üzvlərin payı.*

**PAY**[2] *is.* [*fars.*] *klas.* Ayaq. *Düşəydi payinə bənövşə, sünbül; Xuraman-xuraman əlində də gül.* Q.Zakir. *Fəqət nə güclü, zəif bir vücud var, yahu! Ki, hazıram yıxılıb xaki-payinə hər gün.* C.Cabbarlı. *Görəndə qamətini göz yaşım olur cari; Çəməndə payinə sərvin axan şəlalə kimi.* Ə.Vahid.

**PAYA** *is.* Bir şeyi saxlamaq üçün tir, dayaq, sütun; dirək. *Sınmış şalbanın altına paya vurmaq. – ..Bəziləri paya kəsib hazırlayır, çayın içinə salınmış iri daşların dalına sancıb şəl basır.* Ə.Vəliyev.

**PAYACIQ** *is.* Kiçik paya, balaca paya.

**PAYAÇƏPƏRİ** *is. dan.* Yerə basdırılmış payalardan düzəldilmiş çəpər. *Payaçəpəri çəkmək.*

**PAYALAMA** "Payalamaq"dan *f.is.*

**PAYALAMAQ** *f.* Paya basdırmaq, paya vurmaq. *Üzümlüyü payalamaq.*

**PAYALANMA** "Payalanmaq"dan *f.is.*

**PAYALANMAQ** *məch.* Paya basdırılmaq, paya vurulmaq.

**PAY-BÖLÜŞ: pay-bölüş etmək (eləmək)** – bölüşdürmək, aralarında paylaşdırmaq. *..Şahmar bəy bir neçə ildi mal-dövləti pay-bölüş edib* [Şah bəydən] *aralanmışdı.* Ə.Əbülhəsən. [Nəcəfalı:] *Buyurun yenə başda əyləşin, elin var-yoxunu təzədən pay-bölüş eləyin.* B.Bayramov.

**PAYÇI** *is.* Hər hansı bir işdə payına düşən pulu verərək üzv olan adam (b a x **pay**[1] 6-cı mənada). *Payçıların iclası.*

**PAYDAR** *is.* və *sif.* [*fars.*] *klas.* Davamlı, qaim, sabit, sürəkli. *Bəxtəvər, Vahid, o kəslərdir ki, bu xoş aləmdədir! Hər zaman bu şən həyatı paydar istər könül.* Ə.Vahid. ☐ **Paydar olmaq** – sabit olmaq, qaim olmaq, davam etmək. [Vaqif İrakli xana:] *İnşallah, bundan sonra da sədaqət və vəfadarlığımızda paydar olarıq.* Çəmənzəminli.

**PAYƏ** *is.* [*fars.*] *klas.*: **nə payədə** – nə dərəcədə, nə qədər. [Həsənağa Hacı Quluya:] *Görürsən, hacı, xalq nə payədə qudurub?..* Ə.Haqverdiyev. *İndi bu qədər pulun vəbalı nə payədə ağır olacağını qiyasa gətirib biçarə muzdur yenə ağlamağa başladı.* S.M.Qənizadə.

**PAYƏNDAZ** [*fars.*] b a x **ayaqaltı** 1-ci mənada.

**PAYIZ** *is.* [*fars.*] İlin yaydan sonra gələn fəsli. *Payız yetişdikdə biz uşaqlar üçün yeni bir məşğuliyyət əmələ gəldi..* S.S.Axundov.

**PAYIZGÜLÜ** *is. bot.* Əsasən oktyabr-noyabr aylarında çiçəklənən müxtəlif rəngli iri gül; xrizantem. *Ağ payızgülü. Payızgülü dərmək.*

**PAYIZLIQ** *sif.* Payıza, payız fəslinə məxsus, payız üçün ayrılmış, bir payıza bəs edəcək qədər olan. *Payızlıq yem. Payızlıq taxıl.* // Payızda yetişən, yaxud payızda açan. *..Bir neçə səbət payızlıq armud gətiriləcək.* Ə.Əbülhəsən. // Payızda əkilən. *Payızlıq əkin.* // İs. mənasında. *Yenə maşınlar yaşıllanan payızlıqların yanından ötüb keçirdi.* M.İbrahimov.

**PAYIZSİYƏNƏYİ** *is. zool.* Siyənək balığının gözlərinin iriliyi ilə fərqlənən növü.

**PAYLAMA** "Paylamaq"dan *f.is.*

**PAYLAMAQ** *f.* Çoxları arasında bölüşdürmək, hərəyə öz payını vermək. *Maaş paylamaq.* – [Rüstəm kişi] *borclarını ödədi və hər əməkgününə üç kilo taxıl payladı.* M.İbrahimov. *Yusif sovxozdan cibinə qoyduğu almaları uşaqlarına paylayıb atı rahatladı.* B.Bayramov.

**PAYLANIŞ** *is.* Paylanma işi; paylanma.

**PAYLANMA** "Paylanmaq"dan *f.is.*

**PAYLANMAQ** *məch.* Çoxları arasında bölüşdürülmək, hərəyə öz payı verilmək. *Dəvətnamələr paylandı.* – *Şəhərdə bir neçə şirin quyu vardı ki, buna da keşikçi qoyulmuşdu, növbə ilə xalqa su paylanırdı.* Çəmənzəminli. *Yataqxanada çarpayı paylananda hamı cumub özü üçün yaxşısını seçdi.* Mir Cəlal.

**PAYLAŞDIRILMA** "Paylaşdırılmaq"dan *f.is.*

**PAYLAŞDIRILMAQ** *məch.* Çoxları arasında bölüşdürülmək, hərəyə öz payı verilmək. *Vəzifələr yoldaşlar arasında paylaşdırıldı.* M.S.Ordubadi.

**PAYLAŞDIRMA** "Paylaşdırmaq"dan *f.is.*

**PAYLAŞDIRMAQ** *f.* Çoxları arasında bölüşdürmək, hərəyə öz payını vermək. *Rolları paylaşdırmaq.* – [Oğlan:] *Dedilər, bəyin hər nə mal-dövləti var, əlindən alıb camaata paylaşdıracağıq.* Ə.Haqverdiyev. // Yerləşdirmək, yerbəyer etmək.

**PAYLAŞMA** "Paylaşmaq"dan *f.is.*

**PAYLAŞMAQ** *qarş.* Öz aralarında bölüşdürmək, hərə öz payını götürmək.

**PAYLAYICI** *is. tex.* Maşınlarda, mühərriklərdə, cihazlarda və s.-də qaz, buxar, elektrik enerjisi və s.-nin verilməsini nizama salan hissə, qurğu. *Avtomobilin paylayıcı qutusu. Paylayıcı qurğu.*

**PAYLI-LÜŞLÜ** *sif.* və *zərf dan.* Pay gətirən və ya aparan; payla gələn və ya yola salınan. *Paylı-lüşlü qonaq.* – *Birinci dəfə* [Veysəli] *yadına salan, paylı-lüşlü yanına gələn usta Qaçay idi.* Ə.Vəliyev.

**PAY-LÜŞ** *is. dan.* Pay, hissə, qismət. *Ellər bu dünyadan pay-lüş alanda; Azadlıq sovqatı adıma gəldi.* M.Rahim.

**PAYMAL** *is.* [*fars.*]: **paymal etmək (eləmək)** – ayaq altına salmaq, zəlil etmək, təhqir etmək. *Neyləmişdi sənə Vaqif, a zalım; Onu qəm əlində payimal etdin.* M.P.Vaqif.

**Paymal olmaq** – ayaq altına düşmək, heç olmaq, zay olmaq, məhv olmaq, xar və zəlil olmaq. [Oğlan:] *Evim yıxıldı, cavan ömrüm paymal oldu..* E.Sultanov. [Süleyman bəy:] *Cavan ömrüm paymal oldu, ax, ox!* Ə.Haqverdiyev.

**PAY-PİYADA** *dan.* bax **piyada** 1-ci mənada. *Kəl Həsən Simurqun qanadınnan öpüb, pay-piyada gəlib çıxdı Bəndərpuşa.* (Nağıl). [Murad:] *Nuriyyə xanım stansiyadan pay-piyada gəlirdi.* İ.Əfəndiyev.

**PAYTAXT** *is.* [*fars.*] Dövlətin, hökumətin və hökumət idarələrinin yerləşdiyi baş şəhəri. *Bakı Azərbaycanın paytaxtıdır.*

**PAZ** *is.* Bir şeyi yarmaq, ya genəltmək üçün ucu nazik, getdikcə yoğunlaşan ağac və ya dəmir parçası. *Ağacı pazla yarmaq.*

**PAZAQ** *is. məh.* 1. Olduqca arıq adam.

2. Yağsız ət.

**PAZI** *is. məh.* Çuğundur. □ **Pazı kimi** – çuğundur kimi (tünd-qırmızı, qıpqırmızı). *Həmişə belə tənbehdən sonra qulaqlarım pazı kimi qızarardı.* C.Məmmədquluzadə. *Pristav kitelinin dal cibindən yekə ağ dəsmal çıxarıb, pazı kini qırmızı peysərinin tərini sildi.* Ə.Abasov.

**PAZLAMA** “Pazlamaq”dan *f.is.*

**PAZLAMAQ** *f.* 1. Paz vurmaq, pazla yarmaq.

2. Paz vurub bərkitmək, pazla möhkəmlətmək. *Pərdinin yanını pazlamaq.*

**PAZLANMA** “Pazlanmaq”dan *f.is.*

**PAZLANMAQ** *məch.* 1. Paz vurulmaq, pazla yarılmaq (odun və s.). *Kötüklər pazlandı.*

2. Paz vurulub bərkidilmək, pazla möhkəmlədilmək.

**PAZŞƏKİLLİ** *sif.* Paza oxşar, paz kimi ucu nazik, getdikcə yoğunlaşan.

**PE** “P” hərfinin və bu hərflə işarə olunan samitin adı.

**PEÇ** [*rus.*] *is.* Binaları qızdırmaq, üstündə xörək bişirmək və s. məqsədlər üçün kərpicdən, metaldan düzəldilmiş qurğu; soba. [Gülsənəm] *..otağın düz ortasında qoyulmuş dəmir peçi qaladı.* M.Hüseyn. *Peçin üstündə anasının çoxdan bəri qoyduğu qazançadan qalxan qızartma iyi Gülyazı məst elədi.* Q.İlkin.

**PEÇÁT** [*rus.*] bax **möhür** 1-ci mənada. [Tofiq:] *Gəl, gəl, bu saat mən “hə-yox” cavabını alım, ərizənə peçat basdırım.* M.İbrahimov.

**PEÇENEQLƏR** *cəm* Eramızın IX-XI əsrlərində Cənub-Şərqi Avropada köçəri həyat sürmüş türk mənşəli qədim xalq.

**PEÇENYE** [*rus.* печение – bişmiş] Kövrək, adətən şirin xəmirdən bişirilmiş şirniyyat növü. *Nəcəflə Qızyetər zənbildən iki bükülü konfet, bir qutu peçenye və bir qutu şokolad çıxarıb stolun üstünə qoydular.* M.İbrahimov.

**PEDAQÓGİKA** [*yun.* paidogogike] Tərbiyə, təlim və tədrisin forma və metodlarını öyrənən elm.

**PEDAQOJİ** *sif.* 1. Pedaqoqla əlaqədar olan, pedaqoqla bağlı olan. *Pedaqoji şura. Pedaqoji kadrlar.* // Pedaqoqlar, müəllimlər hazırlamaqla məşğul olan. *Pedaqoji texnikum. Pedaqoji institut.*

2. Pedaqogika ilə əlaqədar olan, pedaqogika ilə bağlı olan. *Pedaqoji ədəbiyyat. Pedaqoji elmlər akademiyası. Pedaqoji elmlər namizədi.*

**PEDAQÓQ** [*yun.* paidogogos] Sənəti müəllimlik və tərbiyəçilikdən ibarət olan adam, pedaqogika sahəsində mütəxəssis. *Yusif bəy həqiqi pedaqoq idi. O, mənim bu pyesimi* [“Hacı Daşdəmir”] *bir növ dil ilə mənə qaytardı ki, mən nə ondan incidim və nə də həvəsdən düşdüm.* Ə.Haqverdiyev.

**PEDAQOQLUQ** *is.* Pedaqoqun işi; müəllimlik, tərbiyəçilik.

**PEDÁL** [*fr.* pedale – ayaq] Müxtəlif maşınlarda, musiqi alətlərində və s.-də ayaq manivelası. *Velosipedin pedalı. Royalın pedalı.* – [Maşinist] *qarşısındakı dəstəkləri və ayaqlarının altındakı pedalları çox məharətlə işlədirdi.* Ə.Sadıq.

**PEDÁNT** [*ital.*] Xırda və formal tələblərin yerinə yetirilməsinə həddindən (lüzumundan) artıq fikir verən adam; xırdaçı, hərf güdən. *Pedantın biridir.*

**PEDANTÍZM** [*ital.*] Həddindən artıq formalizm (rəsmiyyətçilik); ifrat xırdaçılıq.

**PEDANTLIQ** *is.* Hər şeydə həddindən artıq xırdaçılıq göstərmə; pedantizm.

**PEDİ** *is.* Cənubi Afrikada yaşayan xalqlardan biri.

**PEDİÁTR** [*yun.*] Uşaq xəstəlikləri – pediatriya mütəxəssisi olan həkim; uşaq həkimi.

**PEDİATRÍYA** [*yun.* paidos – uşaq və iatreia – müalicə] Tibbin, uşaq xəstəliklərindən, onların müalicəsindən və qarşısını almaq üsullarından bəhs edən şöbəsi.

**PEDİKÜR** [*fr.* pedicure, əsli *lat.* pedis – ayaq və curare – qayğısına qalmaq] Ayaq dırnaqlarının təmizlənməsi, cilalandırılması və ayaqlardakı döyənəklərin rədd edilməsi.

**PEDİKÜRÇÜ** *is.* Pedikürlə məşğul olan qadın (qız).

**PEDİNSTİTUT** *is.* Pedaqoji institut (orta məktəb müəllimləri hazırlayan ali məktəb).

**PEDMƏKTƏB** is. Pedaqoji məktəb (ibtidai məktəb müəllimləri və uşaq bağçası tərbiyəçiləri hazırlayan orta məktəb).

**PEDSOVET** *is.* Pedaqoji şura (məktəb müəllimlərinin, təhsil və inzibati məsələləri həll etmək səlahiyyəti olan iclası).

**PEMZA** [*ing.* əsli *lat.*] Süngər daşı.

**PENCƏK** [*ing.*] Kişi kostyumunun açıq, qatlanan yaxalığı və düyməlınən ətəkləri olan hissəsi. *Osmanla Səlim tanınmaz olmuşdu. Onların başında furajka var idi. Pencəklərinin düymələri və toqqaları parıldayırdı.* İ.Şıxlı.

**PENCƏKLİ** *sif.* Pencək geymiş, əynində pencəyi olan. *Pencəkli oğlan.*

**PENCƏK-ŞALVAR** *is.* Pencək və şalvardan ibarət geyim komplekti; kostyum. *Pencək-şalvar tikdirmək.*

**PENCƏR** *is.* Müxtəlif yeməli yabanı otların (əməköməci, gicitkən, cincilim və s.) ümumi adı. [Nabat Firəngizə:] *Böyük olanda nə olar, bıçağı götür, kətənin pencərini doğra.* B.Bayramov. *Güləsər taxılın içində pencər yığan qızlardan aralanıb atasına doğru gəlirdi.* İ.Şıxlı.

**PENCƏRLİK** *is.* Çoxlu pencər bitmiş sahə, yer. *Pencərlikdən pencər yığmaq.*

**PENDİR** *is.* Maya vurulmuş süddən xüsusi surətdə hazırlanan bərk və ya yarıbərk kütlə şəklində qida məhsulu. *Motal pendiri.* – *Arvadların bir qismi .. südü mayalayıb pendir tuturdu.* İ.Əfəndiyev.

**PENİSİLLİN** [*lat.*] *əcz.* Kif göbələklərinin bəzi növlərindən alınan müalicə preparatı; antibiotik.

**PÉNNİ** *is.* Xırda fin pulu.

**PÉNSİYA** [*lat.*] Qanunun müəyyən etdiyi hallarda (qocalıq, əlillik və s.) vətəndaşlara müntəzəm surətdə verilən pul yardımı. *Pensiya almaq. Qocalığa görə pensiya.* – [Əhməd:] *Mənə hökumət tərəfindən xüsusi pensiya verilir.* Ə.Vəliyev.

**PENSİYAÇI** *is.* Pensiya alan adam.

**PENSNÉ** [*fr.*] Yay vasitəsilə burunun üstünə taxılan gözlük (eynək). *Sallaqbığlı, irigövdəli rəis pensnesini gözündən çıxarıb, təəccüblə Xəlil mirzəyə baxdı.* Q.İlkin.

**PENSNELİ** *sif.* Gözündə pensne olan, pensne taxmış. [Roza ilə Şeyda görüşdüyü halda] *şıq geyimli pensneli Əşrəf daxil olur.* H.Cavid.

**PÉNYA** *is.* [*lat.*] Borclu tərəf öhdəsinə düşən haqqı vaxtında vermədikdə ödəməli olduğu əlavə haqq.

**PERİFERİYA** *is.* [*yun.*] 1. Əyalət, ətraf.

2. *sif. anat.* Ətraf üzvlər.

3. *is. riy.* Çevrənin, fiqurun sərhədi.

**PERİGEY** [*yun.* peri – ətraf və ge – yer] *astr.* Günəş orbitinin Yerə ən yaxın nöqtəsi.

**PERİKMƏK** *f.* Diksinmək, hövllənmək.

**PERİMETR** [*yun.* perimetros] *riyaz.* Yastı həndəsi fiqurun bütün tərəflərinin uzunluğunun cəmi.

**PERİSKÓP** [*yun.* periskopeo – ətrafa baxıram] Örtülü yerdən, sualtı qayıqdan və s.-dən müşahidə aparmaq üçün optik cihaz. *Sualtı qayığın periskopu.*

**PERİTONİT** [*yun.*] *tib.* Qarın boşluğu divarlarını və üzvlərini örtən seroz qişasının iltihabı.

**PERQÁMENT** [Kiçik Asiyada qədim Perqama şəhərinin adından] 1. Kağız icad olunana qədər üstündə yazı yazmaq üçün istifadə olunan xüsusi surətdə işlənmiş heyvan dərisi.

2. Həmin material üzərində yazılmış qədim əlyazması. [Peterburq akademiyasında] *üstü yazılı daşlar və qeyri qədim şeylər, o cümlədən perqament üstə yazılan Quran saxlanır.* "Əkinçi".

3. Yağ və rütubət buraxmayan sıx və möhkəm kağız.

**PERMANÉNT** *sif.* [*lat.*] Arası kəsilmədən davam edən, daimi. *Permanent inqilab. Permanent inkişaf.*

**PERO** [*rus.* перо – lələk] Mürəkkəb, tuş və s. ilə yazmaq üçün yarıq sivri ucu olan metal qələm; qələmucu. *Çernil, qrafil, pero, qarandaş; İcad edəni olaydı şil, kaş!* M.Ə.Sabir.

**PERPENDİKULYÁR** [*lat.* perpendicularis – şaquli] Başqa bir düz xətt və ya müstəvi ilə düz bucaq təşkil edən düz xətt. *Düz xəttə perpendikulyar çəkmək.*

**PERPENDİKULYARLIQ** *is.* Perpendikulyar vəziyyət, perpendikulyar olma. *Müstəvinin perpendikulyarlığı.*

**PERRON** [*fr.*] Dəmiryol stansiyasında qatarların yanaşıb dayandığı meydança; sərnişin platforması. *Qatar perrona yanaşdı. – Tiflisə gedənlərin hamısı gözləmə otağından perrona çıxdılar.* Ə.Vəliyev. [Sadıq] *ipək pijamada perronda gəzinirdi.* Ə.Məmmədxanlı.

**PERSÉY** *is.* [*lat.*] Göyün şimal yarımkürəsindəki bürcün adı.

**PERSOL** *is.* Paltar yuyulmasında istifadə olunan ağardıcı maddə.

**PERSÓNA** *is.* [*lat.*] 1. Şəxs, zat, adam.

2. Tanınmış adam.

**PERSONÁJ** [*fr.*] Bədii əsərdə iştirak edən şəxs; surət, tip. *Mənfi personaj. Komik personaj.* – [“Arşın mal alan”da] *səkkiz personaj iştirak edir.* Ə.Sultanlı.

**PERSONÁL** [*lat.* personalis – şəxsi] Hər hansı bir idarənin, müəssisənin şəxsi heyəti; bir peşə qrupuna daxil olan işçilər. *Tibb personalı.*

**PERSPEKTÍV** [*fr.*] 1. *rəs.* Əşyanın, müşahidə nöqtəsindən uzaqlığından asılı olaraq, gözlə qavranılan cəhətlərinə uyğun şəkildə müstəvi üzərində təsviri. *Şəkildə perspektiv yaxşı verilmişdir.*

2. Uzaq bir müşahidə nöqtəsindən görünən mənzərə, təbiət mənzərəsi.

3. *məc.* Gələcək plan; nəzərdə tutulan, təxmin edilən, gözlənilən şey, gələcək imkanlar; gələcək. *Onun yaxşı perspektivi var. İşin perspektivi. Perspektivi olan sahələr.* // Sif. mənasında. *Perspektiv plan.*

4. **Perspektivdə** şəklində – gələcəkdə, qarşıda, qabaqda. *Perspektivdə böyük işlər var.*

**PERSPEKTİVLİ** *sif.* 1. Perspektivi, gələcəyi olan, inkişaf etməyə yaxşı şəraiti olan. *Perspektivli neft sahəsi. Perspektivli iş.*

2. Perspektivdə əks olunan, perspektiv nəzərdə tutulan (b a x **perspektiv** 1-ci mənada). *Perspektivli dekorasiya.*

**PERSPEKTİVLİLİK** *is.* Perspektivli olma, gələcəyi olma.

**PERSPEKTİVSİZ** *sif.* Perspektivi, gələcəyi olmayan, inkişaf etməyə şəraiti olmayan (b a x **perspektiv** 3-cü mənada). *Perspektivsiz mədən.* – [Mehdizadə:] *..Mən heç gözləməzdim ki, sən belə perspektivsiz işə razılıq verəsən.* Y.Əzimzadə.

**PERSPEKTİVSİZLİK** *is.* Gələcəyi olmama, perspektivsiz olma.

**PÉSO** *is.* [*isp.*] *mal.* Cənubi Amerika ölkələrinin çoxunda dövriyyədə olan pul vahidi.

**PESSİMİST** [*lat.* pessimus – ən pis] b a x **bədbin**.

**PESSİMÍZM** [*lat.*] b a x **bədbinlik**.

**PEŞƏ** *is.* [*fars.*] 1. Sənət. [Dövlətlilərin] .. *peşə öyrənməyə də fikir verməyə macalları olmurdu.* Ə.Əbülhəsən. // İş, məşğuliyyət, sənət. [Hacı Kamyab:] *Sən oğluna nəsihət elə, getsin bir peşəyə yapışsın.* Ə.Haqverdiyev. *Axund, Tahirzadənin yaşını, işini, peşəsini, təhsilini soruşdu.* Mir Cəlal.

2. Adət, xasiyyət, vərdiş. [Fatmanisa:] *Onun köhnə peşəsidir, getdiyi yerdə batıb qalar.* Ə.Haqverdiyev. ..[Yusif] *gecdən-gec dilləndi: – Dedi-qodu yaymaq Qaradonlunun köhnə peşəsidir..* İ.Hüseynov.

**PEŞƏKAR** [*fars.*] 1. *is.* Sənətkar. *Kəndli qızıdır anam, bir peşəkardır babam.* B.Vahabzadə.

2. *sif.* Bir işi, məşğuliyyəti, fəaliyyəti özünə peşə seçmiş. *Peşəkar boksçu. Peşəkar cani. – Peşəkar ovçular hər il dövlətə milyon manatlarla xeyir gətirən xəz-dəri və min tonlarla ət təhvil verirlər.* M.Rzaquluzadə. // İs. mənasında. *Peşəkarların boks yarışı.*

**PEŞƏKARLIQ** *is.* Sənətkarlıq.

**PEŞİN** [*fars.*] b a x **avans**. [Mayor Dilaraya:] *Bəli, xanım, Cavanşir bəyin yalnız peşin olaraq bizdən aldığı məbləğ mühacirətdə sizə ömrünüzün axırına qədər kifayət edər!* Ə.Məmmədxanlı.

**PEŞKƏŞ** *is.* [*fars.*] Bəxşiş verilən, bağışlanan şey; hədiyyə, bəxşiş. *Evlənmək istəyən bir qədər peşkəş özü ilə götürüb, bəyin qulluğuna gedib ondan izn almaq məcburiyyətində idi.* Ə.Haqverdiyev. ◻ **Peşkəş etmək (eləmək)** – hədiyyə vermək, bağışlamaq. **Peşkəş olmaq** – hədiyyə olaraq verilmək, bağışlanılmaq. [Bayram:] *Al bu yaylıq da* [Zalxaya] *peşkəş olsun*. M.F.Axundzadə.

**PEŞMAN** *is.* [*fars.*] Öz səhvini və ya nöqsanını başa düşərək buna təəssüflənmə. *Hacı Nəsir ikinci dəfə evlənməyə çox peşman idi.* S.S.Axundov. ◻ **Peşman olmaq** – b a x **peşmanlamaq**. [Mozalanbəy:] *Bu gecə dürüst fikir elə, peşman olmazsan.* Ə.Haqverdiyev. [Həsən:] *Böyük sözünə baxmayan peşman olar*. H.Nəzərli.

**PEŞMANÇILIQ** 1. B a x **peşmanlıq**. *Bunun axırı peşmançılıqdır, – deyə İmamverdi qardaşını məzəmmət edərdi*. S.S.Axundov. *Gözəlin səsindən peşmançılıq nidaları yağırdı*. M.Hüseyn.

2. **Peşmançılıqla** şəklində *zərf* – təəssüflə, təəssüf hissi ilə, peşman olmuş kimi. [Səməd] *özünün* "*Adsız*" *şerində başına gələnləri sanki peşmançılıqla xatırlayır.* O.Sarıvəlli. *Ballı peşmançılıqla dala çəkildi..* Ə.Əbülhəsən. ◻ **Peşmançılıq (peşmançılığını) çəkmək** – peşman olmaq, gördüyü bir işə sonradan təəssüflənmək. [Hacı Murad:] *Yoxsa peşmançılığını çəkərəm*. S.S.Axundov.

**PEŞMANLAMA** "Peşmanlamaq"dan *f.is.*

**PEŞMANLAMAQ** *f.* Peşman olmaq, peşmançılıq çəkmək.

**PEŞMANLIQ** *is.* Peşman olma, peşmançılıq. ..*Peşmanlıq qara boğanaq kimi birdən* [Zeynalı] *bürüyüb sıxmağa .. başlayırdı*. Çəmənzəminli.

**PEŞMƏK** *is.* [*fars.*] Nazik tellər şəklində şərq şirniyyatı. *Burada şit yağ, camış qatığı, həftəbecər, .. peşmək və iki şüşə konyak var idi..* B.Talıblı.

**PETÍT** [*fr.* petit – kiçik] Kiçik mətbəə şriftlərindən birinin adı. *Mətni petitlə yığmaq*.

**PETLİSA** [*rus.* петлица] Rəsmi geyimlərin yaxalığına tikilən rəngli fərqlənmə nişanı.

**PETROQRAFÍK** *sif.* [*yun.*] Petroqrafiya ilə əlaqədar olan, petroqrafiyaya aid olan. *Petroqrafik tədqiqat*.

**PETROQRÁFİYA** [*yun.* petros – daş, qaya və grapho – təsvir edirəm] Geologiyanın dağ süxurlarını, onların mineraloji və kimyəvi tərkibini, quruluşunu, yayılma, əmələgəlmə qanunauyğunluqlarını və s.-ni öyrənən sahəsi.

**PEY** *is.* [*fars.*] *köhn.* 1. İz, ləpir.

2. Ard, arxa.

3. Kətan kirişi.

**PEYCER** *is.* [*ing.*] Xəbər yetirən, məlumat çatdıran cihaz.

**PEYCİNQ** *is.* [*ing.*] İnformasiya ötürmə və qəbul etmə.

**PEYDA** [*fars.*]: **peyda etmək (eləmək)** – büruzə vermək, göstərmək. *Çox eləyib iztirab peyda; Allahdan etdilər təmənna*. Füzuli. **Peyda olmaq** – büruzə çıxmaq, zahir olmaq, aşkara çıxmaq, görünmək. *Bir vaxt Mədinənin ətrafında böyük bir əjdaha peyda oldu.* Ə.Haqverdiyev. *Otuz beş-qırx il əvvəl, bilmirəm haradansa, meşədə bir pələng peyda olmuşdu.* A.Şaiq.

**PEYDƏRPEY** *zərf* [*fars.*] Dalbadal, bir-birinin ardınca, arasıkəsilmədən. *Hava qaralır, ildırım şığıyır, göy peydərpey guruldayır..* Ə.Haqverdiyev. ..*Gözlər təzədən qızıb, ürəklər təzədən döyünürdü, çomaqlar peydərpey enib qalxırdı..* Çəmənzəminli.

**PEYĞAM** *is.* [*fars.*] *klas.* Xəbər, sifariş. *Vaqifəm, canana göndərdim peyğam; Gözüm yollarında qaldı sübhü şam.* M.P.Vaqif.

**PEYĞƏMBƏR** *is.* [*fars.*] 1. Müxtəlif dini etiqadlara görə, Allahın əmrlərini xəbər verən və şərh edən şəxs; rəsul, nəbi. *Yüz iyirmi dörd min peyğəmbərimiz; Hər birinin ayrı məqamı vardır.* Aşıq Ələsgər.

2. *məc.* Gələcəkdən xəbər verən şəxs.

3. *məc.* Təmiz, pak, müqəddəs adam mənasında. [Kərəm Salmana:] *Sən də yaxşı deyirsən, tanımayan elə bilər ki, peyğəmbərsən*. M.İbrahimov.

**PEYĞƏMBƏRÇİÇƏYİ** *is. bot.* Açıq-göy rəngli yabanı gül.

**PEYĞƏMBƏRİ** b a x **qarğıdalı**.

**PEYĞƏMBƏRLİK** *is.* 1. Rəsulluq, nəbilik. *Peyğəmbərlik tam ruhanilikdir, çünki insanlıq dərəcəsində peyğəmbərlikdən daha yüksək mövqe yoxdur.* "Qabusnamə".

2. *məc.* Gələcəkdən xəbər vermə. ◻ **Peyğəmbərlik etmək** – gələcəkdən xəbər vermək.

**PEYİN** *is.* Üzvi gübrə kimi işlədilən saman, xəzəl və s. qatışığından ibarət heyvan və quş ifrazatı. *At peyini.*

**PEYİNDAĞIDAN** b a x **peyinsəpən**.

**PEYİNQURDU** *is. zool.* Peyinliklərdə yaşayan cücü.

**PEYİNLƏMƏ** "Peyinləmək"dən *f.is.*

**PEYİNLƏMƏK** *f.* Peyinlə gübrələmək, peyin vermək. *Bostanı peyinləmək.*

**PEYİNLƏNMƏ** "Peyinlənmək"dən *f.is.*

**PEYİNLƏNMƏK** *məch.* Peyinlə gübrələnmək, peyin verilmək.

**PEYİNLİ** *sif.* Peyin səpilmiş, peyin tökülmüş, peyin verilmiş. *Peyinli lək.*

**PEYİNLİK** *is.* Peyin yığılmış yer, peyin olan yer. [Sərçələr qışda] *gündüzlər özlərini həyətə, tövləyə, pəyəyə, peyinliyə, evlərin dəhlizlərinə soxaraq yem* . S.S.Axundov. *Çayqırağının yaxşı bir cəhəti də bu idi ki, su və peyinlik yaxın olduğundan, burada .. lobya, soğan əkirdilər*. Ə.Əbülhəsən.

**PEYİNSƏPƏN** *sif. k.t.* Əkiləcək sahəyə peyin səpmək üçün işlədilən. *Peyinsəpən maşın*. // İs. mənasında. *Peyinsəpəni təmir etmək. Yeni markalı peyinsəpən*.

**PEYK** *is.* Planet və ya ulduzun ətrafında fırlanan göy cismi. *Ay Yerin peykidir. Yupiterin 11 peyki vardır*. ◻ **Süni peyk** – tədqiqat məqsədi ilə raket vasitəsilə kosmosa buraxılan və göy cisimləri kimi müəyyən orbiti olan cihaz, qurğu. *Yerin süni peyki.*

**PEYKAN** *is.* [*fars.*] Əsil mənası "oxun ucundakı sivri dəmir" olub, klassik ədəbiyyatda "kirpik, (gözəlin kirpiyi)" mənasında işlənmişdir. *Əlhəzər, yay qaşın, şux peykanından; Vurar, yıxar, ötmək olmaz yanından*. Q.Zakir. *Əzrayılı qanlı tutmasın anam; Məni bir kirpiyi peykan öldürür.* Aşıq Ələsgər.

**PEYLƏMƏ** "Peyləmək"dən *f.is.*

**PEYLƏMƏK** *f. dan.* Xəncər, bıçaq və s. ilə vurmaq, vurub öldürmək, ya yaralamaq. [Siçan:] *Bu pişiyin atını bir peyləyin; Xakə yıxın, ömrünü tey eyləyin*. S.Ə.Şirvani.

**PEYLƏNMƏ** "Peylənmək"dən *f.is.*

**PEYLƏNMƏK** *məch. dan.* Xəncər, bıçaq və s. ilə vurulmaq, vurulub öldürülmək, ya yaralanmaq. *İki dəqiqə çəkmədi ki, peylənmiş* (f.sif.) *dəvə kimi nərə çəkib göyə qalxdı*. Mir Cəlal.

**PEYMAN** [*fars.*] b a x **əhd** 1-ci mənada. *Nədən ləğv oldu peymanlar; Verildi odlu fərmanlar*. M.Ə.Sabir. ◻ **Peyman bağlamaq (etmək)** – əhd bağlamaq. *Ovçu vermədi aman; Toruna düşdü tərlan; Yarla peyman bağlayıb; Qoymuşam yolunda can.* (Bayatı). [Vahid:] [Anam] *and içib peyman elədi ki, mən iyirmi beş yaşına çatanda atam barədə hər şeyi mənə açacaqdır..* B.Bayramov. **Peymanını sındırmaq (pozmaq)** – əhdini sındırmaq (pozmaq). *Səbəb nə oldu ki, peymanü əhdi sındırdın?* X.Natəvan. *Unudur verdiyi əhdi, ilqarı; Pozur peymanını tez insan oğlu.* Aşıq Şəmşir.

**PEYMANƏ** *is.* [*fars.*] *klas.* 1. Qədəh, piyalə. *Sındırma qəlbini peymanə kimi*. M.Rahim.

2. *məc.* Çaxır, şərab mənasında. *Qara gözlər süzülüb sərməst olur peymanədən; Ahu tək hərdən dönüb baxmağı öldürdü məni.* M.P.Vaqif. *Təğafül etməsin, işrət çağıdır; İçilir hər yerdə peymanə, gəlsin*. Q.Zakir.

**PEYRƏVİ** *is.* [*fars.*] *klas.* Qabaqda gedən, rəhbər. // Dalınca gedən, arxasınca gedən.

**PEYSƏR** *is.* [*fars.*] Başın arxa tərəfi. *Bayram .. usta Pirəlinin qırmızı, dolğun üzünə və yoğun peysərinə baxırdı.* M.Hüseyn. *Şapkasının uzun günlüyü Səmədə diqqətlə baxmağa mane olurmuş kimi Yusif onu peysərinə itələdi.* İ.Hüseynov.

**PEYVƏND** *is.* [*fars.*] 1. *k.t.* Müəyyən xüsusiyyət vermək üçün bir bitki gözcük və ya saplağının başqa bitkiyə calanması; qələm, calaq. ◻ **Peyvənd etmək (vurmaq)** – qələm etmək, calamaq. *Vurduq ağaclara biz peyvənd, calaq.* M.Seyidzadə.

2. *tib*. Hər hansı bir xəstəliyin qarşısını almaq və ya onu zəiflətmək məqsədilə bədənə vaksin yeritmə. *Qızılcaya qarşı peyvənd.* ◻ **Peyvənd etmək (vurmaq)** – bədənə vaksin yeritmək. *Uşağı peyvənd etmək.*

3. *məc.* Bitişmə, canlanma. *Bir şişə ki, oldu parə-parə; Peyvəndinə varmı hiç çarə?* Füzuli. ◻ **Peyvənd etmək** – bir-birinə calamaq, bitişdirmək. *Məryəm isə onun boynunu qucub sözlərini, sorğularını bir-birinə peyvənd edərək dedi..* C.Cabbarlı.

**PEYVƏNDLƏMƏ** "Peyvəndləmək"dən *f.is.*

**PEYVƏNDLƏMƏK** *f.* 1. Peyvənd etmək, calaq etmək, qələm etmək. *Alma ağacını peyvəndləmək.*

2. Peyvənd vurmaq, peyvənd etmək. *Qripə qarşı peyvəndləmək.*

**PEYVƏSTƏ** *is.* [*fars.*] *klas.* Daim, həmişə, müttəsil. *Peyvəstə bizə yetər bəlası; Novfəl qəzəbindən et qiyası.* Füzuli. *Çox çəkir hicrini Vaqifi-xəstə; Leylü nahar, şamü səhər peyvəstə.* M.P.Vaqif.

**PƏDƏR** *is.* [*fars.*] *klas.* Ata. *Pədərim Salehdir, madərim Reyhan.* Molla Cümə. *Şad oldu pədər, madəriniz, – bu boya çatdız.* M.Ə.Sabir.

**PƏDƏRŞAHLIQ** *is. tar.* Kişi qohumluğu xəttinə əsaslanan və kişinin hakim olduğu qəbilə qruplarından ibarət ibtidai icma quruluşunun son dövrü; patriarxat.

**PƏHLƏVAN** *is.* [*fars.*] 1. Çox güclü adam; qəhrəman, igid. *Gəzinir ortada səkkiz pəhləvan; Əyri qılınclardan sanki damır qan.* H.K.Sanılı. *Şərqin bütün pəhləvanları, sərkərdələri, qəhrəmanları, igidləri buradadır.* M.S.Ordubadi.

2. Güləşmə ilə məşğul olan idmançı; güləşçi. *İkinci dərəcəli pəhləvan.*

**PƏHLƏVANİ** b a x **qəhrəmani**.

**PƏHLƏVANLAŞMA** "Pəhləvanlaşmaq"-dan *f.is.*

**PƏHLƏVANLAŞMAQ** *f.* Qoçaqlaşmaq, cəsurlaşmaq, pəhləvan olmaq, cəsarətlənmək. *..Ağagül pəhləvanlaşan* (f.sif.) *dostunun üzünə mat-mat baxdı.* S.Rəhimov.

**PƏHLƏVANLIQ** *is.* İgidlik, qəhrəmanlıq, qoçaqlıq. *Kişilər dəm vurur pəhləvanlıqdan; Güləşdən, gülllədən, ölümdən, qandan.* S.Vurğun. *Qollarını niyə çırmalamısan, kişi, yoxsa pəhləvanlıq eləmək fikrindəsən?* M.İbrahimov.

**PƏHMAYİ** *is. zool.* Enli bədəni olan balıq növü.

**PƏH-PƏH** b a x **bəh-bəh**. [Hacı Məhəmmədəli:] *Pəh-pəh, pəh! Maşallah olsun doktor cənablarının elminə.* C.Məmmədquluzadə. [Sultan bəy:] *Bəli! Sultan bəyin qızı bir gədəyə aşıq olubdur, pəh-pəh, pəh!* Ü.Hacıbəyov.

**PƏHRİZ** *is.* [*fars.*] Müəyyən yemək rejimi. *Bu camıma şərab süz, pəhriz etmək hədərdir; İçimdə atəşim var, pəhriz edim mən nədən?* Şəhriyar. ☐ **Pəhriz gözləmək (saxlamaq)** – müəyyən yemək rejiminə riayət etmək. *Xəstə pəhriz gözləməlidir.* – [Həkim:] *Beş-on il dözər can; Ciddi pəhriz saxlasan.* R.Rza.

**PƏHRİZKAR** *is.* [*fars.*] Pəhriz gözləyən (saxlayan), pəhriz rejiminə riayət edən adam.

**PƏHRİZKARLIQ** *is.* Pəhrizini gözləmə, ona riayət etmə. *Hər iki dünyanın neməti sənətdə, bütün sənətlərin açarı elm və tərbiyədədir. Xüsusilə, nəfsi tərbiyə etmək, təvazökarlıq, pəhrizkarlıq, düz danışmaq, təmiz adlı olmaq, başqalarına əziyyət verməmək və həyalı olmaq çox yaxşıdır.* "Qabusnamə".

**PƏJMÜRDƏ** *sif.* [*fars.*] Üzünün rəngi qaçmış, solğun, pərişan, halı pozğun. *Halı pəjmürdə, sanki bir məcnun; Anlaşılmaz nədir məramı onun?!* H.Cavid. *Otaqdan qarasifət, dolaşıq saçlı, pəjmürdə bir qadın çıxıb balkonda durdu.* Çəmənzəminli. *Məşədi İbad pərişan və pəjmürdə bir hal ilə küçədə vaqe olur.* Ü.Hacıbəyov.

**PƏJMÜRDƏLİK** *is.* Pəjmürdə adamın görkəmi; solğunluq, pərişanlıq.

**PƏL** *is.*: **pəl qatmaq (vurmaq)** – bir işə maneçilik törətmək, əngəl olmaq, pəlləmək. *..Onu vuran adam ümumi işə pəl qatır, tək özünə yox, gördüyü xeyirli işə də əngəl törədir..* M.Hüseyn. [Gilə Nəbiyə:] *Biz toya çoxdan hazırıq. Gülüstanın ölümü, nə bilim, aranın qarışması işimizə pəl vurdu.* Ə.Abasov.

**PƏLƏ** *sif.* Yastı, enli. [Koroğlu] *pələ bığlarını eşib qulaqlarının dalına keçirdi.* "Koroğlu".

**PƏLƏBIĞ(LI)** *sif.* Yekə, yastı və uzunbığlı.

**PƏLƏQULAQ(LI)** *sif.* İri, yastıqulaqlı. *Balacaboylu, kök, pələqulaq, yekəburun bir uşaq əlini yuxarı qaldırıb dedi.* Ə.Abasov.

**PƏLƏNG** *is.* 1. Pişik cinsindən dərisi zolaqlı iri yırtıcı heyvan; qaplan. *.. Sədinin bir sözü çıxmır yadımdan: Pişiyin duruşu rəngbərəng olur; Pələngi görəndə o, siçanlaşır; Siçanı görəndə o, pələng olur.* X.Rza.

2. *məc.* İgid, qoçaq mənasında. *Baş bədənnən yarpaq kimi tökərəm; Mənəm əsil*

*cəzirənin pələngi*. "Koroğlu". *Əsirgəmir ondan patron-tüfəngi; Bəsləyir yoxsullar o gənc pələngi*. H.K.Sanılı. *Tüfəng tutan bu ərlər; Bəslədiyim pələnglər; Nəyim varsa sənindir*. S.Vurğun.

**PƏLƏNGİ** *sif.* Rəngarəng, ala-bəzək. *Pələngi parça*.

**PƏLƏNGLİK** *is.* İgidlik, qoçaqlıq, rəşadət.

**PƏLLƏMƏ** "Pəlləmək"dən *f.is.*

**PƏLLƏMƏK** *f. məh.* İşə maneçilik törətmək, pəl vurmaq, pəl qatmaq.

**PƏLMƏ** *is. dan.* Tutqun, aydın olmayan, yarıişıq, zəif işıq.

**PƏLMƏLƏNMƏ** "Pəlmələnmək"dən *f.is.*

**PƏLMƏLƏNMƏK** *f. məh.* Rəngləri çıxaraq bir-birinə qarışmaq, ala-bula olmaq. *Xalıların, cecimlərin .. və döşəklərin boyaları bir-birinə qarışaraq pəlmələnmişdi*. Çəmənzəminli.

**PƏLTƏK** *sif.* Dilini dişlərinin arasına alaraq danışan, buna görə də "r", "l" və s. səsləri düzgün tələffüz etməyən. *Pəltək uşaq. – Pəltək oğlanın utandığını hiss edən Qüdrət, səsinə mehriban bir ifadə verdi..* M.Hüseyn.

**PƏLTƏKLİK** *is.* Danışarkən bəzi səsləri düzgün tələffüz edə bilməməkdən ibarət nitq nöqsanı. *Pəltəkliyi müalicə etmək. – Oğlan məhz pəltəkliyinin gülüşə səbəb olduğunu düşünüb, qulağının dibinəcən qızardı*. M.Hüseyn.

**PƏNAH** *is.* [*fars*] 1. Sığınma, birinin yanına qaçıb ondan himayə və kömək istəmə. ☐ **Pənah etmək (eyləmək)** – 1) özü üçün sığınacaq etmək, məskən etmək. *Aləmin dərdü qəmindən xəbərin yox, Seyyid; Mən ki meyxanəni illərdi pənah eyləmişəm*. S.Ə.Şirvani; 2) b a x **pənah aparmaq**. **Pənah gətirmək (aparmaq)** – bir adamın yanına, bir yerə sığınaraq ondan imdad, sığınacaq istəmək. *..Züleyxa çəkdiyi məşəqqətlərdən cana gəlib, öz qardaşlarının evinə pənah gətirdi*. C.Cabbarlı. **Pənah yeri** – sığınacaq, pənahgah. [Köçəri quşların] *bütün pənah yerləri bağların qaratikan çəpərləri idi ki, orada az-çox yem tapa bilirdilər*. S.S.Axundov.

2. *məc.* Himayəçi, arxa, dadaçatan, istinadgah, pənahgah. *Səməd üzünü Məşədi Heydərə tutub, qaş-göz elədi və Nadiri göstərərək belə bir qüvvətli pənahı olduğunu işarə etdi*. B.Talıblı. ☐ **Pənah çıxmaq** – himayəsi altına almaq, qayğısını çəkmək. [Zeynəbə Qara Kərəmoğlu] *bir qardaş, bir ata kimi pənah çıxdı, işə çəkdi, uşaqlarını kolxoz bağçasına aldı*. M.İbrahimov. **Pənah olmaq** – 1) imdadına çatmaq, kömək etmək; 2) b a x **pənah çıxmaq**. **Pənahında saxlamaq** – himayə etmək, himayəsində saxlama, qayğısını çəkmək; qorumaq, hifz etmək. *Hərami qaşların fitnədir karı; Onu pənahında saxlaya tarı*. Q.Zakir. [Şamama Cadu:] *Allah səni öz pənahında saxlasın, cavan qəddini yerə vurmasın*. Ə.Haqverdiyev. // *məc.* Ümid, dayaq. *Qarı öz yeganə pənahı nəvəsini bir parça çörəkpulu üçün yenə də bazara yola salmaq istəyirdi*. S.Rəhimov. *Körpələrin pənahısan; Anaların gözü səndə*. N.Rəfibəyli.

**PƏNAHGAH** *is.* [*fars.*] 1. Pənah aparılan yer, pənah yeri, sığınacaq yeri. [Adamlardan biri:] *Sən hər şeydən əvvəl bizə bir pənahgah tap ki, biz oradan düşmən ilə vuruşaq*. P.Makulu.

2. *məc.* Allah mənasında. [Gövhər xanım:] *Ey cəmi yaranmışın pənahgahı! Oğlumu səndən istəyirəm*. S.S.Axundov.

**PƏNAHLANMA** "Pənahlanmaq"dan *f.is.*

**PƏNAHLANMAQ** *f.* Pənah aparmaq, pənah gətirmək, imdad istəmək; sığınmaq. [Bədəl:] *Yəqin hər kəs isə .. bizə pənahlanmağa gəlir, qoy gəlsin görək*. Ə.Haqverdiyev.

**PƏNBƏ** *sif. şair.* Açıq-al, gül rəngində. *Sevda gəlinlərə məxsus pənbə tüllər içində olaraq gələr..* H.Cavid. *Soldu yavaş-yavaş pənbə yanaqlar; Gülümsündü acı gülgün dodaqlar*. Ə.Cavad.

**PƏNCƏ** *is.* [*fars.*] 1. Əl ayası ilə beş barmaq birlikdə. *Pəncəsini açmaq. – Nəbi pəncəsinə sığmayan bafanı yerə qoyub, belini düzəltdiyi zaman günəş onu salamladı*. Ə.Abasov. // Heyvanların qabaq ayaqlarının barmaqları ilə dırnaqları. [Pələng] *də məni görmüşdü, pəncəsilə acıqlı-acıqlı yeri eşir, dırmalayırdı*. A.Şaiq. [Tula] *sağ pəncəsini yarı qaldırıb bükmüş, .. özü isə heykəl kimi hərəkətsiz durmuşdu*. M.Rzaquluzadə.

2. Ayağın dabandan başqa, barmaqların da daxil olduğu alt hissəsi. *Pəncəsinə tikan batıb. – Eldar .. pəncələri üstündə yeriyərək reproduktorun səsini kəsmək üçün əlini uzatdı.* M.Rzaquluzadə. ..[Zabit] *pəncələri üstündə qalxıb-düşərək özündən razı halda səhranı seyrə daldı*. M.İbrahimov. // Ayaqqabı altlığının həmin hissəsi. *Çəkməyə pəncə vurdurmaq*.

3. Bir əl tutacaq qədər taxıl, ot və s. *Alov iri ağzını geniş açaraq yığılmış taxılı, pəncələri, bağlanmamış bafaları udurdu.* Ə.Vəliyev. *Onların biçdikləri yerdə nəinki pəncə, hələ dərz də gözə az dəyirdi*. Ə.Əbülhəsən. // Bir əl tutacaq miqdar. *Bir pəncə plov.*

4. Kultivator və s.-də torpaqda kiçik şırımlar açan hissə. *Kultivatorun pəncəsi*.

5. *məc.* Qüvvət, zor, zor-güc; məngənə. *Ölümlərin pəncəsində hıçqıran; Məzlumların nəvasından yarandım*. M.Müşfiq. *Zülmün pəncəsində inlərkən cahan; İlk azadlıq sözü səndən ucalmış..* N.Rəfibəyli.

◊ **Pəncəsindən qurtarmaq (xilas olmaq)** – əlindən qurtulmaq, azad olmaq, xilas olmaq. **Pəncəsinə düşmək (keçmək)** – əlinə keçmək, tutulmaq. [Qacar:] *Keçdi pəncəmizə gözəl Qarabağ; Öpsün qılıncımı hər qaya, hər dağ!* S.Vurğun. *Aya, hankı cəlladın pəncəsinə keçdiniz; Neçin böylə qəddiniz sındı, büküldü, dağlar?* M.Müşfiq.

**pəncə-pəncə** *sif.* Üzərində pəncə şəklində gülləri, naxışları olan. *Pəncə-pəncə parça. – Bir də görərdin ki, dövlətli qadın pəncə-pəncə donunu geydi.* H.Sarabski.

◊ **Pəncə-pəncəyə gəlmək** – b a x **pəncələşmək**. *Ölümlə pəncə-pəncəyə gəlmək. – Buludlar gəldikcə pəncə-pəncəyə; Sanasan varlığın ürəyi əsir.* S.Vurğun.

**PƏNCƏKEŞ** *is.* [*fars.*] Çörəyin üzərinə naxış salmaq üçün alət.

**PƏNCƏLƏMƏ** "Pəncələmək"dən *f.is.*

**PƏNCƏLƏMƏK** *f.* Pəncəsi ilə qapıb götürmək. *Plovu pəncələmək*.

**PƏNCƏLƏŞMƏ** "Pəncələşmək"dən *f.is.*

**PƏNCƏLƏŞMƏK** *f.* Çarpışmaq, vuruşmaq, mübarizə aparmaq. *Ölümlə pəncələşmək.* – [Qüdrət:] *Gecə ilə gündüz pəncələşir.* M.S.Ordubadi. *Dağlarla, daşlarla pəncələşərək; İnsan istiqbalı salama gəlir..* S.Vurğun. *Bütün qışı tufanlarla; Pəncələşən neft ustası; Baxır aydın üfüqlərə; Ürəyində yaz sevdası*. N.Rəfibəyli.

**PƏNCƏRƏ** *is.* 1. İşıq və hava gəlmək üçün evin və s. divarında açılan deşik və həmin deşiyi qapayan şüşəli çərçivə. *Pəncərəni açmaq. Pəncərəyə şüşə salmaq*.

2. *dan.* Mühazirələr, dərslər arasında boş qalan vaxt; fasilə. *Pəncərədə bekar qalmaq.*

**PƏNCƏRƏALTI** *is.* Pəncərənin alt tərəfinə vurulan taxta. *Pəncərəaltını yonmaq*.

**PƏNCƏRƏLİ** *sif.* 1. Pəncərəsi olan. *Bu, qaya içində salınmış, qabağında kiçik daş səkisi olan, torpaq damlı, kiçikcə pəncərəli, bir qapıcığazlı daxma idi*. Ə.Əbülhəsən.

2. *dan.* Pəncərəsi olan; fasiləli (b a x **pəncərə** 2-ci mənada). *Pəncərəli dərs cədvəli*.

**PƏNCƏRƏSİZ** *sif.* Pəncərəsi olmayan. [Almaz Camala:] *Burada nə var? Uçuq-sökük daxmalar, pəncərəsiz, işıqsız komalar.* C.Cabbarlı.

**PƏNCƏRƏÜSTÜ** *is.* Pəncərənin üst tərəfinə vurulan taxta və ya qoyulan iri daş. *Pəncərəüstünü yonmaq*.

**PƏNCƏÜZGƏCLİLƏR** *cəm, zool.* Üzgəcləri pəncə şəklində olan heyvanlar fəsiləsi.

**PƏNCŞƏNBƏ** *is.* [*fars.*] Cümə axşamı. *Molla Xəlil həftənin pəncşənbə və cümə günlərini məsciddə oxuyacağını bildirmişdi.* S.Hüseyn.

**PƏND** *is.* [*fars.*] *klas.* Nəsihət. *Mürşidin pəndini eyicə saxla; Damardan, ilikdən, qandan içəri*. Xətayi.

**PƏPƏ** *is.* 1. *uş*. Çörək.

2. Qırıntı, ovuntu. *Çörək pəpəsi*.

**PƏPƏŞ** b a x **pəpə** 1-ci mənada.

**PƏPƏYEYƏN: məməyeyəndən-pəpəyeyənə kimi (qədər)** – b a x **məməyeyən**. *Əhalidə olan bu sevinc məməyeyəndən-pəpəyeyənə kimi hamının ürəyindən axıb gəlirdi.* Ə.Vəliyev.

**PƏR** *is.* [*fars.*] 1. Quş tükü.

2. Qanad (klassik ədəbiyyatda çox vaxt "pərü bal" şəklində işlənmişdir). *Bilməm bu qəfəsdə nola halım; Sındırdı bəla pər ilə balım.* Füzuli. *Mənim şahinim də pərü balını; Gərir üfüqlərə ehtişam ilə*. M.Rahim. ☐ **Pər**

**açmaq (vurmaq)** – qanad açmaq, qanad çalmaq, uçmaq. *Simurq göydə pər vurub, nər kimi nərildəyirdi*. (Nağıl).

3. B a x **qanad** 4-cü mənada. *Suyun şəffaflığından dənizin dibi görünürdü: məxmər kimi yaşıl yosun, xırda və iri daşlar, üz-üzə pərlərini geniş açıb oynaşan balıqlar..* M.Süleymanov.

4. Müxtəlif maşın və qurğuların fırlanan hissəsi, qanadı. *Yeldəyirmanın pəri. Ventilyatorun pəri. Təyyarənin pəri. – Dəyirman pərləri elə fırlanır ki, görmək olmur*. Mir Cəlal. // Dəyirman çarxının üzərinə su tökülüb hərəkətə gətirilən hissəsi. *Novdan lülələnib çıxan qüvvətli su qocanın qayırmış olduğu bir cüt dəyirman daşının pərinə çırpılırdı*. S.Rəhimov.

**PƏRAKƏNDƏ** *zərf* və *sif.* [*fars.*] 1. Bir yerdə və müntəzəm halda olmayan; nizamsız, qarmaqarışıq, dağınıq. *Qoşun dəstə-dəstə, pərakəndə bir halda gəlib-keçirdi*. Çəmənzəminli. *Direktor masanın üstündə pərakəndə halda olan kağızları nizama saldı.* Q.İlkin. ◻ **Pərakəndə düşmək (olmaq)** – dağılmaq, dağınıq hala düşmək, mütəşəkkilliyini itirmək, darmadağın olmaq. [Qasid:] *Yerdə qalanın bir hissəsi Cəfərqulu xan tərəfə keçdi və qalanı pərakəndə olub, hərəsi bir yana qaçdı.* Ə.Haqverdiyev. [Hadi Lələ:] *Bu xanədanın, dağılıb pərakəndə düşməyinə bais olma.* S.S.Axundov.

2. Dağınıq, pərişan. *..Nərgizin görkəmi, Mixailin pərakəndə saqqalı karıxmış Gön Çərkəzin inamını artırırdı*. B.Bayramov. [Məryəmin] *pərakəndə halda çiyninə səpilmiş uzun şabalıdı saçları, təzə açmış gül kimi saf çöhrəsi .. Səlimi məst edirdi*. H.Seyidbəyli.

◊ **Pərakəndə satış** *tic.* – topdan deyil, ədədlə və ya az miqdarlarla satılan, yaxud alınan (istehlak malları haqqında). *..Çoxişlənən mallar üçün aşağı salınan vahid dövlət pərakəndə satış qiymətləri qoyulmuşdu*. (Qəzetlərdən).

**PƏRAKƏNDƏLİK** *is.* Pərakəndə şeyin hal və vəziyyəti; dağınıqlıq, nizam-intizamsızlıq, qarmaqarışıqlıq. *Gənc leytenantın .. üzündə, uzun qara kirpikli gözlərinin qapanışında, qara, qıvrım saçlarının pərakəndəliyində çox pərişan bir görkəm var idi*. Ə.Vəliyev. // Adda-buddalıq, dağınıqlıq, müəyyən qayda və səliqənin olmadığı hal. *Belə pərakəndəlik, evlərin müxtəlif biçimi, .. yolların toz-torpaqlı olması* [Şahmarı] *darıxdırırdı*. B.Bayramov.

**PƏRÇİM** *is.* İki şeyi bir-birinə bağlamaq (bənd edib bərkitmək) üçün metal mil və onun döyülüb yastılanan ucu. ◻ **Pərçim etmək (eləmək)** – 1) b a x **pərçimləmək**; 2) sıx bir yerə təpilmək, soxulmaq, girmək. *Kəklik .. özünü bir kola pərçim elədi.* B.Bayramov. **Pərçim olmaq** – 1) sığışmadığı dar bir yerə təpilərək heç bir yana dönə və ya çıxa bilməmək, sıxılıb qalmaq. *Dar paltar geyəndə adam pərçim olur. Stoluna pərçim olmuş stolbazı; tanı, fəqət saya salma.* X.Rza; 2) bir şeyin içinə girmək, sancılmaq, sancılıb qalmaq, ilişmək, ilişib qalmaq. *Hirslə şığıyan tərlanın ürəyindən pərçim olan iti qələmənin neştər ucu onun kürəyindən çıxmışdı.* S.Rəhimov.

**PƏRÇİMLƏMƏ** "Pərçimləmək"dən *f.is.*

**PƏRÇİMLƏMƏK** *f.* 1. Pərçimlə bağlamaq, bərkitmək. *Döşəməsilənin hissələrini pərçimləmək.*

2. Soxmaq, sancmaq. *Xəncəri ürəyinə pərçimləmək.*

**PƏRÇİMLƏNMƏ** "Pərçimlənmək"dən *f.is.*

**PƏRÇİMLƏNMƏK** *məch.* 1. Pərçimlə bağlanmaq, bərkidilmək.

2. Özünə yer eləmək, girmək. *Kitab da vardır ki, hər sətri mismar; Zorla pərçimlənir beynə, ağıla.* S.Vurğun.

3. İlişib qalmaq, çıxmamaq, ilişmək. *Balta quyuda pərçimləndi.*

4. Vurulmaq, sancılmaq, girmək, batmaq. *Xəncər ürəyinə pərçimləndi*.

**PƏRDƏ** *is.* [*fars.*] 1. Qapı, pəncərə və s.-dən asılan örtü və ya bir yeri iki hissəyə ayırmaq üçün asılan iri parça. *Tül pərdə. Pərdə ilə otağı iki hissəyə bölmək. Qapıya pərdə salmaq. – Gün İmranın üstünə düşəndə qarı dirəklərin arasına pərdə tutardı.* İ.Şıxlı.

2. Teatrda səhnəni tamaşa salonundan ayıran asılmış iri örtü. *Pərdə qalxır, Əsgər oxuyur..* Ü.Hacıbəyov. *Səhnədən yeni pərdə asılmışdı*. Ə.Sadıq.

3. Səhnə əsərlərinin ən böyük hissələrindən hər biri. *İki şəkildən ibarət pərdə. Balet üç pərdədən ibarətdir. Birinci pərdədə çıxış*

*etmək. – Əsərin ən gərgin yerləri olan IV və V pərdələrdə Almaz şiddətli həyəcanlar keçirir*. M.Arif. *Tamaşanın ikinci pərdəsi oynanırdı*. Mir Cəlal.

4. Bəzi simli musiqi alətlərinin (tar, saz və s.) qolundakı bölmələrdən hər biri (bunların hər birinə barmaqla və ya mizrabla toxunduqda başqa bir səs çıxarır). *Oğlan sazın zil pərdəsini dilləndirir*. A.Şaiq. [Məmməd aşığa:] *Barmağın gəzdikcə pərdələrdə, mən; Min ilham almışam o nəğmələrdən*. Z.Xəlil. *Muğamdakı həzin-həzin pərdələrdən; Divarların dönəminə naxış vurdun*. B.Vahabzadə.

5. Mayenin üzərində əmələ gələn təbəqə. *Südün üzərindəki yağ pərdəsi. Gölməçə neft pərdəsi ilə örtülüdür*.

6. *məc*. Bir şeyi hər tərəfdən örtən, bürüyən, qapayan nazik təbəqə. *Toz pərdəsi. Duman pərdəsi. – Gecənin pərdəsi tamam söküldü; Günəşin telləri yerə töküldü.* H.K.Sanılı. *Çiçək öz gülüşü ilə Muxtarın sifətindəki xəcalət pərdəsini yırtdı*. Ə.Vəliyev.

7. *anat.* Canlı orqanizmdə bir boşluğu ikiyə bölən nazik təbəqə. *Qulaq pərdəsi. Göz pərdəsi*.

8. *məc.* Çarşab, ümumiyyətlə, görməyə mane olan şey mənasında. *Pərdədə saxlanma, çıx, ey sevgili dildarımız*. M.Hadi. ☐ **Pərdə çəkmək** *məc*. – b a x **pərdələmək**. *Məni çox gənc ikən ağlatdı zaman; Çəkərək pərdə o xoş mənzərəyə*. Ə.Cavad. **Pərdəyə bürünmək** – üstü örtülmək, görünməz olmaq. *Bütün şəhər qaranlıq bir pərdəyə bürünmüşdü*. S.Rəhman.

9. *məc.* Örtü, örtük. *Dan yeli hər yana ətir dağıdır; Çöllərə çəkilir yaşıl bir pərdə*. A.Şaiq. *Qara buludlar qalın bir pərdə kimi göy üzünü örtmüşdü.* M.İbrahimov. *Elə bil üfüqə .. bozumtul pərdə çəkilmişdi*. Ə.Əbülhəsən.

10. *məc.* Böyüklə kiçik, yaxud qadınla kişi arasında gözlənilməli olan hörmət, abır-həya hissi. *Arada pərdə olmalıdır.*

◊ **Pərdəni aradan götürmək** – b a x **pərdəni yırtmaq**. [Məzlum:] *Aslan, belə danışma, gəl pərdəni aradan götürməyək.* S.Vəliyev. **Pərdəni yırtmaq** – böyüklə kiçik arasında gözlənilməli olan hörmət münasibətini pozmaq, gözləməmək; abır, həya hissini itirmək. *İnsan nə iş görsə gərək pünhani görsün, pərdəni yırtmasın.* S.Rəhimov. **Pərdəsini qaldırmaq** – açıb göstərmək, aşkara çıxarmaq, üzə çıxarmaq, aşkar etmək. *Qaldır pərdəsini keçmişin bir az; Bax! Kimdir sahildə duran ixtiyar..* R.Rza. **Gözdən pərdə asmaq** – b a x **göz**. [Kazım:] *Görürəm səninlə danışmaq çox çətindir, Kosaoğlu. Sən başa düşmürsən ki, hökuməti aldadıb gözdən pərdə asmaq ən böyük cinayətdir?!* İ.Şıxlı.

**pərdə-pərdə** *zərf* Bir pərdədən o biri pərdəyə keçərək, pərdələri səsləndirərək (b a x **pərdə** 4-cü mənada). *Səsləndi pərdə-pərdə ruhumdakı rübabım*. M.Müşfiq. *Tarçı çalaraq pərdə-pərdə qalxmağa başladı*. Ə.Məmmədxanlı.

**PƏRDƏARASI** *sif.* Pərdələr arasında olan (b a x **pərdə** 3-cü mənada). *Pərdəarası fasilə.*

**PƏRDƏLƏMƏ** "Pərdələmək"dən *f.is.*

**PƏRDƏLƏMƏK** *f.* 1. Qabağını örtmək, tutmaq, görünməz etmək. *Duman günəşi pərdələdi*.

2. *məc.* Üstünü örtmək, ört-basdır etmək, gizlətmək. *Öz məqsədini pərdələmək. Cinayəti pərdələmək.* – [Vəliəhd:] *Əlbəttə, hər anda və hər kəsin andına inanmaq olmaz, çünki bəzən andlar yalanları doğrultmaq, bəzən də həqiqəti pərdələmək məqsədlərinə xidmət edir.* M.S.Ordubadi. // Üzə vurmamaq, göstərməmək, büruzə verməmək, gizlətmək. *Cuma arvadına qarşı duyduğu soyuqluğu pərdələmək haqqında düşündü..* Ə.Əbülhəsən.

**PƏRDƏLƏNMƏ** "Pərdələnmək"dən *f.is.*

**PƏRDƏLƏNMƏK** *məch.* 1. Örtülmək, qabağı tutulmaq, görünməz olmaq. *Ayın solğun işığı hərdən bulud ilə pərdələnib, uşaqları qaranlığa qərq edirdi.* C.Cabbarlı.

2. *məc.* Üstü örtülmək, ört-basdır edilmək, gizlədilmək. *Rus ədəbiyyatının çox zəngin təcrübəsindən, elə də öz ədəbi təcrübəmizdən bilirik ki, heç bir böyük yazıçının yaradıcılığındakı nöqsanlar pərdələnmir*. S.Rəhimov.

3. *qayıd.* Örtünmək, özünü bir şeylə örtərək görünməz etmək.

**PƏRDƏLİ** *sif.* 1. Pərdəsi olan, pərdə salınmış, pərdə asılmış. *Pərdəli qapı. – Pəncərəsi ipək pərdəli evlərdə; Min təlaş var, min həşir.* R.Rza.

2. Saylardan sonra gələrək, səhnə əsərinin neçə pərdədən ibarət olduğunu göstərir. *Üç pərdəli komediya. Dörd pərdəli drama.*

3. *Zərf mənasında*. Aradakı hörmət, həya, ədəb normalarına riayət edərək. [Mirzə Cəmil] *qızla pərdəli dolanmaq, həyalı rəftar etmək fikrində idi*. Ə.Vəliyev.

4. *məc*. Açıq olmayan, üstüörtülü. *Pərdəli söz*. – [Qoca:] *Oğlum, sən pərdəli* (z.) *danışdın, sözlərini anlamadım, nə demək istəyirsən?* A.Divanbəyoğlu. *Pərdəli, ikimənalı danışıqlardan da xoşum gəlməz*. Ə.Vəliyev.

**PƏRDİ** *is*. Damın üstünə, taxta və ya küləşin altına qoyulan tir. *Nazik pərdi. Damın pərdisi çürümüşdür*. – *Külək əsir, şaxta kəsir; Pərdilərdən asılmışdır sırsıralar*. R.Rza. *Pərdiləri və taxtaları hisdən qapqara olan tavandan asılmış yeddilik lampa .. buranı çox pis işıqlandırırdı*. Ə.Əbülhəsən.

**PƏRDİLƏMƏ** "Pərdiləmək"dən *f.is*.

**PƏRDİLƏMƏK** *f*. Dama pərdi düzmək, damın üstünə pərdi uzatmaq. *Damı pərdiləmək*.

**PƏRDİLİK** *sif*. Pərdi üçün yarar, pərdi üçün yonulub hazırlanmış. *Pərdilik şalban*. // İs. mənasında. *Pərdilik kəsmək*.

**PƏRƏ** *is*. Burnun xarici deşiklərindən hər biri. [İlyas:] *Hirsindən* [Tərlanın] *geniş açılmış burun pərələri elə bil od saçırdı*. Ə.Məmmədxanlı. *Qaya atın sakit qalxıb-enən burun pərələrini Cəmilə göstərdi*. Q.İlkin.

**PƏRƏK**[1] *is*. Girdə yastı metaldan (əsasən qızıldan, gümüşdən) düzəldilmiş yastı, ortası deşik bütöv dəyirmi nazik lövhəciklərdən ibarət qadın bəzəyi. *Qızıl pərək. Gümüş pərək*. // Parıldayan materialın xırda, nazik qırıntısı. *Gəlinin üzünə ağ-sarı pərəklər yapışdırıb, başına parlaq cığcığa tökdüklərindən onun hər tərəfi parlayırdı*. M.S.Ordubadi.

**PƏRƏK**[2] b a x **pərə**. ..*Burun pərəkləri geniş açılmış .. zərif Qarabağ atı birdən qılçaları biçilmiş kimi yerə sərildi*. M.Rzaquluzadə.

**PƏRƏKLİ** *sif*. Üzərində pərək olan, üzərinə pərək yapışdırılmış və ya səpilmiş (b a x **pərək**[1]). [Xanımın] ..*ortadan ayrılmış saçlarının üzərində qızıl pərəkli araqçın yan qoyulmuşdu*. Çəmənzəminli. *Elə bil ulduzlar üzünə gümüş pərəkli bir duvaq salmış, .. sahildə cərgələnmiş şümşad qamətli ağaclar əsrlik tamaşasına durmuşdu*. Ə.Məmmədxanlı.

**PƏRƏQULAQ** *sif*. b a x **sallaqqulaq**.

**PƏRƏN-PƏRƏN: pərən-pərən düşmək (olmaq)** – bir-birindən aralı düşmək, bir-birini itirmək, hərə bir yerə dağılmaq. *Balaca uşaqlar ayaqyalın titrəyə-titrəyə və ağlaya-ağlaya pərən-pərən düşmüşdülər*. C.Məmmədquluzadə. [Ağasıxan:] *Kəndlər xaraba haldadır, hamı pərən-pərən olub, dağılıb. ..Bunun dalı aclıqdır*. Çəmənzəminli. *Düşdü quşun balaları; Yuvasından pərən-pərən*. M.Dilbazi; **pərən-pərən salmaq (etmək)** – bir-birindən aralı salmaq, bir-birindən ayırmaq, hərəni bir yerə atmaq, dağıtmaq. *Müharibə ailə üzvlərini pərən-pərən etdi*. – *Midhət də quzğun sürüsünü pərən-pərən saldı*. Ə.Vəliyev.

**PƏRƏSTAR** *is*. [*fars*.] 1. Xidmətçi, qulluqçu, qul, cariyə.

2. *məc*. Pərəstiş edən, pərəstişkar. ☐ **Pərəstar olmaq** – baxmaq, xidmət etmək, himayə etmək.

**PƏRƏSTARLIQ** *is*. Baxma, himayəçilik, himayə etmə, pərəstar olma. ☐ **Pərəstarlıq etmək** – b a x **pərəstar olmaq** ("**pərəstar**"da). *Ancaq Səfdərin bacısı Reyhan xanım naxoşa pərəstarlıq edirdi*. T.Ş.Simurq.

**PƏRƏSTİŞ** *is*. [*fars*.] 1. Sitayiş etmə, tapınma, ibadət etmə, səcdə etmə. ☐ **Pərəstiş etmək** – sitayiş etmək, tapınmaq, ibadət etmək, ilahiləşdirmək, səcdə etmək. *Bütlərə pərəstiş etmək*. – *Bir güruh eylər pərəstiş vəhdətə..* H.Cavid. // Dərin hörmət.

2. *məc*. Məftunluq, həddindən artıq vurğunluq; məhəbbət. ☐ **Pərəstiş etmək** – məftun olmaq, həddindən artıq pərəstiş dərəcəsində sevmək. [Xavər Arifə:] *Xavər sana etsə də pərəstiş; Heyhat, dönərmi bir də keçmiş!..* H.Cavid. [Surxay:] *Sus, Aydın! Gültəkinin o şairanə heyatınə, o füsunkar gözəlliyinə hər kəs pərəstiş edir*. C.Cabbarlı.

**PƏRƏSTİŞKAR** *is*. 1. Pərəstiş edən, tapınan sitayiş edən; ibadət edən. ☐ **Pərəstişkar olmaq** – pərəstiş dərəcəsində sevmək, məftun olmaq, vurulmaq. *Sevgilim, eşqü həvəsdən daha mən bizaram; İndi bir başqa dilarama pərəstişkaram*. A.Səhhət. [Əzra Zəhraya:] *Səndə bir öylə hüsnü cazibə var; Ki, olur hər görən pərəstişkar*. H.Cavid.

2. *məc*. Pərəstiş dərəcəsində sevən; məftun, vurğun. [Rasim Yavərə:] *Etiraf etməliyəm*

*ki, mən də bu cür sənətin pərəstişkarıyam*. M.İbrahimov.

**PƏRƏSTİŞKARANƏ** *zərf* Pərəstiş edərcəsinə, sitayişkaranə, dərin hörmətlə. *Şeyda dərhal yerindən qalxar, pərəstişkaranə bir tövrlə ona doğru irəlilər*. H.Cavid.

**PƏRGAR**[1] *is.* [*fars.*] Dairə çəkmək və çertyojlarda xəttin uzunluğunu ölçmək üçün iki qollu alət; sirkul. *Pərgarla dairə çəkmək*.

**PƏRGAR**[2] *sif.* [*fars.*] Bacarıqlı, bacaran, usta. [Hacı Murad:] *De görüm, yeməkdə pərgarsan, ya yox!* S.S.Axundov. [Nərminə:] *Deməyə, danışmağa pərgarsan, ancaq əlindən bir iş gəlmir*. B.Bayramov.

**PƏRGAR**[3] *is.* [*fars.*] Qayda, səliqə, nizam; bir şeyin saz vəziyyəti. *Evimizə ozan gəlibdir; Pərgar pozan gəlibdir; Gündüz olan işləri; Gecə yazan gəlibdir.* (Bayatı).

**PƏRGAR**[4] *is.* [*lat.* Circinus] Göyün Cənub yarımkürəsində bürc.

**PƏRGARLAMA** "Pərgarlamaq"dan *f.is.*

**PƏRGARLAMAQ** *f.* Nizam-intizam yaratmaq, qaydaya, səliqəyə salmaq; sahmanlamaq. *Sabahdan etibarən öz evlərini lazımınca pərgarlarsan.* M.S.Ordubadi.

◊ **Qurşağının altını pərgarlamaq** – qarnını doydurmaq, yaxşıca yeyib doymaq. [Xəlil:] *Qurşağın altını pərgarlayandan sonra bığları eşib, buğlana-buğlana gediniz.* N.Vəzirov.

**PƏRGARLAŞMA** "Pərgarlaşmaq"dan *f.is.*

**PƏRGARLAŞMAQ** *f.* Ustalaşmaq, mahirləşmək, bişmək, məharət qazanmaq. *İşdə pərgarlaşmaq. – Və o gündən .. zenit topları düşmən tanklarını yandırmaqda pərgarlaşmağa başladı.* Ə.Əbülhəsən.

**PƏRGARLIQ** *is.* Ustalıq, mahirlik, bacarıq, məharət.

**PƏRİ** *is.* [*fars.*] 1. Əsatirdə: cinlərin çox gözəl və cazibəli qadın şəklində təsəvvür olunan qismi.

2. *məc.* Çox gözəl, məsum, xoşxasiyyət qadın və ya qız haqqında. *Başına döndüyüm, ay qəşəng pəri; Adətdir, dərərlər yaz bənövşəni!* Qurbani. *Yox mənim başqa pərilərdə, gözəllərdə gözüm.* S.Rüstəm. *Ey könlümü bir yol güldürən pəri; Niyə ağlar qoydun illərcə məni.* Ə.Cavad.

◊ **İlham (şeir) pərisi** – sənətkara ilham verən, onu ruhlandıran, şövqə gətirən amil. *İlham pərisinin açdığı dadlı; Dillərdən küsərəm, səndən küsmərəm!* M.Müşfiq. *Ey ilham pərisi, varsansa əgər; Bu axşam üstümə qanadını gər; Qanım bir hərarət alsın qanından; Çıxım bu fikirlər burulğanından.* M.Araz.

**PƏRİCAMAL** [*fars.* pəri və *ər.* cəmal] b a x **pəriüz(lü)**. *Yüz vədeyi-vüsal eləsin ol pəricamal; Nərgis gəlib görünməsinin ehtimalı yox.* S.Ə.Şirvani.

**PƏRİÇÖHRƏ** [*fars.*] b a x **pəriüz(lü)**. *Bu pəriçöhrələr eşqində gözəldir, Vahid! Qəzəli sən deyəsən, mən oxuyam əzbərdən.* Ə.Vahid.

**PƏRİSİMA** [*fars.* pəri və *ər.* sima] b a x **pəriüz(lü)**. *Ey pərisima, sənin didarının müştaqiyəm.* M.P.Vaqif.

**PƏRİSURƏT** [*fars.* pəri və *ər.* surət] b a x **pəriüz(lü)**.

**PƏRİŞAN** *sif.* və *zərf* [*fars.*] 1. Dağınıq, qatma-qarış, nizamsız. *Ağarmış saçları çiyninə tökülmüş, pərişan saqqallı bir qoca .. dar küçə ilə gedirdi.* Çəmənzəminli. *..Səlim* [Mehribanın] *tərləmiş üzünə tökülmüş pərişan saçlarını bir tərəfə edib alnının tərini sildi.* S.Hüseyn. ☐ **Pərişan etmək** – pərən-pərən salmaq, dağıtmaq, darmadağın etmək. *Girsə o səngərə tək bir qəhrəman; Bütün bir alayı edər pərişan.* H.K.Sanılı. **Pərişan olmaq** – darmadağın olmaq, pərən-pərən düşmək; dağılmaq. *Havada parladı qızıl bir nişan; Gərayın dəstəsi olub pərişan..* S.Vurğun.

2. Qəmli, kədərli, qüssəli. *Pərişan gəzirsən bütün aləmi; Gözündə ilk bahar zimistan olur..* S.Vurğun. [Afət:] *Yaramı açma gəl, Pəri, qan gedər; Afət bu dünyadan pərişan gedər*. M.Rahim. ☐ **Pərişan etmək** – çox məyus etmək, kədərləndirmək, qüssələndirmək, qəmləndirmək. *Bir tərəf şanə dağıtdı zülfünü, bir yan səba; Hər tərəfdən hər biri könlüm pərişan etdilər.* S.Ə.Şirvani. *Bütün ömründə çox az xəstələnən, son illər heç xəstələnməyən Böyükkişinin qəflətən yorğan-döşəyə düşməsi xanımın halını olduqca pərişan etmişdi.* S.Rəhimov. **Pərişan olmaq** – qəmlənmək, kədərlənmək, qüssələnmək, çox məyus olmaq. *İstəsən könlüm kimi zülfün pərişan olmasın; Ol qədər cövr et mənə ah etmək imkan olmasın!* M.Ə.Sabir.

**PƏRİŞANLIQ** *is.* 1. Dağınıqlıq, qatma-qarışıqlıq, nizamsızlıq. *Pərişanlıq zülfün öz qaydasıdır; Nə badi-səbadən, nə şanədəndir.* M.P.Vaqif.

2. Qəmlilik, kədərlilik, qüssəlilik, məyusluq. *Çünki var idi bizdə nadanlıq; Bizə üz verdi çox pərişanlıq*. S.Ə.Şirvani. *Hacı Nəsir ..* [Nurəddinin] *pərişanlığından qəmgin olardı..* S.S.Axundov.

**PƏRİÜZ(LÜ)** *sif. şair.* Pəriyə oxşayan, pəri kimi gözəl (gözəlin epitetlərindən biri).

**PƏRİZAD(Ə)** *is.* [*fars.*] Folklorda və şeirdə gözəlin epitetlərindən biri. *Adam gərək görsün həqqi aradə; Hanı sənin kimi bir pərizadə.* M.P.Vaqif.

**PƏRQU** *is.* [*fars.*] 1. Qu quşunun yumşaq tükü. *Şiraslan üst-başı lələk, pərqu içində özünü içəriyə soxdu*. M.Süleymanov.

2. İçində pərqu olan. *Pərqu balış. – Sən ki pərqu yorğan-döşəyə uzanan kimi qarın içinə uzanıbsan!* M.Rzaquluzadə.

**PƏRLİ** *sif.* 1. Pər (3-cü mənada) olan. *Balığın pərli üzgəci*.

2. Pər (4-cü mənada) olan. *Pərli çarx*.

**PƏRLİ-BUDAQLI** *dan.* b a x **qollu-budaqlı**. *..Pərli-budaqlı buynuzunu şax tutub yeriyən maral onu görən kimi yaxınlaşıb əlini iylədi.* İ.Şıxlı.

**PƏRPƏRƏNG, PƏRPƏTÖYÜN** *is. bot.* Yumşaq, ətli yarpaqları və incə çiçəkləri olan, yerə yatıq, bişirilib yeyilən yabanı ot-bitki.

**PƏRPUÇ** *is.* [*fars.*] *köhn.* Yox etmə, ləğv etmə, məhv etmə. *Məktəbdə qoyun ustulu, dasqanı, – deyirlər; Pərpuç eləyin çubifələqqanı, – deyirlər...* M.Ə.Sabir.

**PƏRSƏNG** *is.* [*fars.* parə səng – daş parçası] 1. Tərəzinin gözlərini tarazlaşdırmaq üçün qoyulan daş və s. *Boş tərəzinin gözləri bir-birilə taraz gəlmədi.* [Kosa] *daşı götürdü, pərsəng atdı, qıraqları çürümüş çanaqları birtəhər düzəlişdirdi.* S.Rəhimov. // İçində şeylə çəkiləcək qabın ağırlığı, çəkisi. □ **Pərsəngini tutmaq** – qabın (taranın) çəkisini (ağırlığını) təyin etmək.

2. *məc.* Çəki, əhəmiyyət, ağırlıq. *Hər sözün bir pərsəngi var.* (Ata. sözü). *Geymisən pərsəngini; Gey, sallan pərsəngini; Desəm dağlar götürməz; Dərdimin pərsəngini.* (Bayatı).

3. *məc.* Danışarkən söz arasında yerli-yersiz təkrar edilən, deyilən söz, ifadə.

◊ **Pərsəng aparmaq** – ağlı çatışmayan, özünü gic kimi aparan adam haqqında.

**PƏRŞUM** *is. k.t.* Təkrar şum, ikinci şum.

**PƏRŞUMLAMA** "Pərşumlamaq"dan *f.is.*

**PƏRŞUMLAMAQ** *f. k.t.* Pərşum etmək, ikinci dəfə şumlamaq, təkrar şumlamaq.

**PƏRT** *sif.* Əhvalı pozğun, tutqun, pərişan, bir şeydən inciyərək pozulmuş, məyus olmuş, incimiş; incik. *Qüdrət İsmayılzadə .. evinə çox pərt* (z.) *qayıtmışdı*. M.Hüseyn. *Rüstəm kişi acıqlı, pərt və fikirli idi*. M.İbrahimov. □ **Pərt etmək** – bir söz deməklə utandırmaq, yaxud qəlbinə toxunmaq, məyus etmək, əhvalını pozmaq, ruhən incitmək. *Səni son məktubumla bir az pərt eləmişdim; Bunu özümə sonra yaman dərd eləmişdim*. S.Rüstəm. **Pərt olmaq** – b a x **pərtləşmək**. *Rəşid pərt olub, çaşmış bir halda səkinin kənarında dayandı*. Ə.Məmmədxanlı. *Aydın utanıb, bir qədər pərt oldu.* H.Seyidbəyli.

**pərt-pərt** *zərf* Pərt halda. *Mirzə Əliməmməd isə pərt-pərt qapıya baxaraq doğma qardaşının buraya gəlməsindən heç də razı qalmadı.* Çəmənzəminli.

**PƏRTLƏŞMƏ** "Pərtləşmək"dən *f.is.*

**PƏRTLƏŞMƏK** *f.* Bir səbəb (söz, hərəkət və s.) üzündən pərt olmaq, ürəyi sınmaq, məyus olmaq, tutulmaq, qanı qaralmaq. *Kazım bir az da pərtləşərək sözünə davam etdi*. Çəmənzəminli. [Naşad] *Mehribanın sözündən pərtləşdi.* S.Hüseyn.

**PƏRTLİK** *is.* Pərt olmuş adamın halı; məyusluq, inciklik, qanıqaralıq. *Rəhimbəy* [oğlunun] *pərtliyini yalnız neçə gündən bəri saxladığı küsü ilə izah edirdi.* M.Hüseyn. *Sübhanverdizadənin pərtliyi get-gedə artırdı*. S.Rəhimov.

**PƏRTÖV**[1] *is.* [*fars.*] *klas.* İşıq, nur, ziya, şüa, parlaqlıq. *Xurşid rüxündən aldı pərtöv*. Füzuli.

**PƏRTÖV**[2] *sif.* [*fars.*] Səliqəsiz, nizamsız, laqeyd. // Narahat; rahatlıq, sakitlik, dinclik bilməyən, daim çalışıb-çapalayan.

◊ **Ağızdan pərtöv** – b a x **ağzıpərtöv**. [Misir] *ağızdan pərtöv, küsəyən idi..* Ə.Vəliyev.

**PƏRTÖVLÜK** *is.* Səliqəsizlik, nizamsızlıq; laqeydlik. // Narazılıq, rahatsızlıq; sakitlik, dinclik bilməmə, daim çalışıb-çapalama.

**PƏRVANƏ** *is.* [*fars.*] 1. Adətən işığın ətrafına dolaşan kiçik gecə kəpənəyi. *Məndən öyrənibdir oda yanmağı; Düşəndə xəbər al pərvanələrdən.* Q.Zakir. [Ərəstu:] *Pərvanə vurğundur işığa, nura.* A.Şaiq. // Ümumiyyətlə, kəpənək.

2. B a x **pər** 4-cü mənada. *Növbə Kamala yetişəndə o, əlindəki modelin pərvanəsini buraxdı..* M.Rzaquluzadə.

◊ **Pərvanə kimi (tək) başına fırlanmaq (dolanmaq)** – həddindən artıq sevmək, istəmək, mehribanlıq göstərmək, nəvaziş etmək, nazlamaq, əzizləmək. *Günəş, Arazın ciyərlərini sağaltmaq üçün onun başına pərvanə kimi dolanır.* A.Şaiq. *Vaxt məni pərvanətək başına dolandırır; Dünən qanmadığımı bu gün mənə qandırır.* B.Vahabzadə.

**PƏRVAZ** *is.* [*fars.*]: **pərvaz etmək** – b a x **pərvazlanmaq**. *Sürü yaxınlaşdıqca çöldəki quşlar qalxıb uçuşur, sonra oturur, yenə sürü yaxınlaşanda havaya pərvaz edirdilər.* T.Ş.Simurq; // *məc.* uçmaq, şadlanmaq, ruhlanmaq, qanadlanmaq (adətən könlü, ruhu və s. sözlərlə birlikdə). *Vaqifin də könlü çox edər pərvaz; Hərdən sizin ilə gəzə, durnalar!* M.P.Vaqif. *Gəlin sizə söhbət açım ürəyimin sözündən; Yenə könlüm pərvaz eylər bu dağları görəndə.* S.Vurğun.

**PƏRVAZLAMA** "Pərvazlamaq"dan *f.is.*

**PƏRVAZLAMAQ** *f.* 1. Uçurmaq. *Quşu pərvazlamaq.*

2. *məc.* Ruhlandırmaq, qanadlandırmaq. *Bu sayaq unudub ağır möhnəti; Rəna pərvazladı ilk məhəbbəti.* M.Rahim.

**PƏRVAZLANMA** "Pərvazlanmaq"dan *f.is.*

**PƏRVAZLANMAQ** *f.* 1. Uçmaq. *Göyərçinlər pərvazlanır; Qərar tutmur yuvada.* S.Rüstəm. *Yalnız arabir su üzərində dəstə ilə uçuşan və təkdənbir suyun səthinə qədər enib, yenə də sürətlə havaya pərvazlanan* (f.sif.) *quşlar görünürdü.* M.Hüseyn. // Qanad çıxarmaq, qanadı çıxmaq, uçmağa başlamaq. *Laçın pərvazlanıb uçan vaxtıdır; Şikar ovlağına şux tərlan gəlir.* Aşıq Şəmşir. *Bala quş həmişə anasının yanında qalmır. Bir az böyüyəndən sonra pərvazlanır, özünə yuva tikir, ana olur.* Ə.Abasov.

2. *məc.* Qanadlanmaq, qol-qanad açmaq, ruhlanmaq. [Qəndab:] *..Çox eşitmişdim ki, qızın üstünə ad qoyulan kimi o, qol-qanad açır, böyüyür, pərvazlanır.* B.Bayramov.

**PƏRVAZLAŞMA** "Pərvazlaşmaq"dan *f.is.*

**PƏRVAZLAŞMAQ** *f.* Pərvazlanmağa başlamaq, yenicə qanad açmaq. [Uşaqlar] *hərdən əllərini quma verib dırmaşanda yeni pərvazlaşan* (f.sif.) *bala kəkliyə oxşayırdılar.* Mir Cəlal.

**PƏRVƏRDİGAR** *is.* [*fars.*] Allah, Tanrı. *Kamalında, camalında eyib yox; Pərvərdigar vermiş hər hünər sənə.* M.P.Vaqif. // **Pərvərdigara** şəklində – Ay Allah! Tanrım! (Allaha xitab).

**PƏRVƏRİŞ** *is.* [*fars.*] Bəsləmə, yedirib-içirmə, qulluq etmə, yetişdirmə, qulluq, tərbiyə. *Üç körpə uşağın pərvəriş, təlim və tərbiyəsi anam Dürnisənin öhdəsinə düşür.* S.S.Axundov. ◻ **Pərvəriş tapmaq (etmək)** – böyümək, inkişaf etmək, yetişmək. *..Hər bir bakteri və mikrob süddə yaxşı pərvəriş edir, onun içinə düşüb xəstəliyə səbəb olurlar.* H.Zərdabi. *Dağların başında, təmiz havada pərvəriş tapan qız o qədər böyümüş və gözəlləşmişdi ki, gərək iki göz olub ona tamaşa eləydi.* E.Sultanov. **Pərvəriş vermək** – böyütmək, bəsləmək, bəsləyib-böyütmək, yetişdirmək, tərbiyə vermək.

**PƏRVİN** *is.* [*fars.*] Ülkər, Yeddiqardaş ulduzu; Sürəyya. *Bizim palıdlarımız kəmənd atır Pərvinə; Ay da, ulduz da düşər palıdın kəməndinə.* Şəhriyar.

**PƏS**[1] *dan.* b a x **bəs**[2]. *Camaat yerbəyerdən dərvişi alqışlayıb deyirdilər: – Pəs belə padşah olmaz.* (Nağıl). *..Pəs rəfiqlərimizi intizarçılıqdan çıxartmaqdan ötrü gənə gərək bir neçə söz ərz edəm..* C.Məmmədquluzadə.

**PƏS**[2] *is.* [*fars.* pəst] Aşağı səs, alçaq səs. *Bülbül oxur, səsi var; Həm zili, həm pəsi var. Şirin sözlü dilbərin; Can alan qəmzəsi var.* (Bayatı).

**PƏSAB** *is.* [*fars.*] Alçaq keyfiyyətli sirkə, şərab və s.

**PƏSDƏN** *zərf* Alçaq səslə, aşağı səslə; alçaqdan, yavaşcadan. *O xımır-xımır pəsdən oxuyan kim idi? – deyə soruşdu.* A.Şaiq. *Nəsimin laylayıdır, yoxsa neyin naləsidir; Dinlə pəsdən, ya da zildən niyə nalan gəldi?* Şəhriyar.

**PƏSƏND** *is.* [*fars.*]: **pəsənd eləmək (etmək)** – bəyənmək, xoşlamaq, saymaq. *O za-*

*man ayları, ulduzları sən; Gecələr eyləyəcəksənmi pəsənd?* M.Müşfiq. *Dövlətlilər .. yoxsul toylarında qarmonçalan Minayəni pəsənd eləməzdilər.* Ə.Əbülhəsən.

**PƏSXAN** *is.* [*fars.*] Aşağı səsdə oxuyan, bəmdə oxuyan xanəndə. [S.Şuşinski] *həm bəm səsdə* (*pəsxan*)*, həm orta səsdə* (*miyanəxan*)*, həm də zildə* (*zilxan*) *məharətlə oxuyur.* (Qəzetlərdən).

**PƏSMƏNDƏ** *sif.* [*fars.* pəsmandə] *dan.* Yatıb qalmış, satılmayan, işə getməyən, artıq qalan. *Nemətullayevin rəhbərliyi altında rayona gələn mallar bölünə-bölünə davam edər və dükanların qəfəsələrinə pəsməndə mallar gəlib çıxardı.* S.Rəhimov.

**PƏST** *is.* [*fars.*] *köhn.* 1. Alçaq (hündür, uca, yüksək olmayan).

2. *mus.* Aşağı registrdə yavaş səslə oxumaq; bəm. *Pəstdən oxumaq.*

**PƏSTƏHA** *is.* [*fars.*] 1. Hissə, detal. *Maşının pəstəhası.*

2. *məc.* Fırıldaq, hiylə, kələk, hoqqa. [Niyaz:] *Di yaxşı, şələni götür, düş yola, səndən çox pəstəhalar çıxacaq.* Ə.Haqverdiyev. [Hacı Fərəc:] *Gəlsin görək qaraçı oğlu qaraçı, nə pəstəha olacaq.* N.Vəzirov.

**PƏŞƏNG** *is.* *köhn.* 1. Üzüm salxımı.

2. Tumluq üçün saxlanan tərəvəz bitkisi.

**PƏTƏ** *is.* Bir şey almağa hüquq verən vərəqəcik. *Benzin pətəsi. – Bir gün anam yüklərin hesabını saxlamaq üçün ona pətə verdikdə, o, anamın əlini tutdu.* C.Cabbarlı.

**PƏTƏK** *is.* Bir-birinə yapışmış xırda gözcüklərdən ibarət arı yuvası. *İskəndərin atası əkinçi idi: iki inəyi, 10-15 qoyun-keçisi, 6 da arı pətəyi var idi.* E.Sultanov. *Həyətdə arı pətəyi saxlayan Məsmə bir səhər durub pətəklərin yerini boş görmüşdü..* Mir Cəlal.

**PƏTƏKLİK** *is.* Arı pətəkləri olan yer, arıçılıq təsərrüfatı; arıxana.

**PƏTƏNƏK** *is.* Mədə (quşlarda). *Pətənəkləri çuvaldan böyük, iştahaları həddən ziyadə... Utanmaq bilməzlər, həya etməzlər...* N.Vəzirov.

**PƏYƏ** *is.* Tövlə. [Bir şəxs:] *Məmmədhəsən əmi, tez oğlanı göndər, pəyədən eşşəyi çıxartsın..* C.Məmmədquluzadə. [Şahmar] *pəyəni kürüyüb çıxanda başından buğ qalxırdı.* B.Bayramov.

**PƏZƏVƏNG** *sif.* Yekə, zorba, zırpı (bəzən söyüş mənasında). [Həsən:] *Bilməm bu pəzəvəng haradan gəldi də işləri bərbad etdi.* H.Nəzərli. [Ağasəfər:] *Adə, ey .. çayqıraqlı pəzəvəng hərif!* Ə.Əbülhəsən.

**PƏZƏVƏNGLİK** *is.* Yekəlik, zorbalıq, zırpılıq.

**PIÇAPIÇ** b a x **pıç-pıç**. *Şəhərdə bir pıçapıç düşdü ki, day Allah göstərməsin.* "Koroğlu".

**PIÇHAPIÇ** b a x **pıç-pıç**. *Pıçhapıç danışmaq. – Aralığa pıçhapıç düşdü.* S.Rəhman.

**PIÇILDAMA** "Pıçıldamaq"dan *f.is.*

**PIÇILDAMAQ** *f.* Yavaşcadan, pıçıltı ilə demək (çox vaxt "qulağına" sözü ilə). [Məhəmmədcəfər] *əyilib yavaşcadan qulağıma pıçıldadı.* Qantəmir. *Diyar kişi dirsəyi ilə arvadına toxunub pıçıldadı.* Ə.Məmmədxanlı. // *məc.* Obrazlı təşbehlərdə. *Qovaq ağaclarının yarpaqları sanki yoldan ötənlərə nağıllar pıçıldardı.* Ə.Məmmədxanlı.

**PIÇILDAŞMA** "Pıçıldaşmaq"dan *f.is. Eyhamlar, tanış-biliş arasında pıçıldaşmalar .. indi də davam edirdi.* İ.Hüseynov.

**PIÇILDAŞMAQ** *qarş.* Bir-biri ilə pıçıltı ilə danışmaq, söhbət etmək. *Həmzə Allahqulu ilə bir az pıçıldaşıb, sonra dedi.* Ə.Əbülhəsən. *Oğlanlar* [Mehribana] *baxaraq pıçıldaşırdılar.* H.Seyidbəyli. // *məc.* Obrazlı təşbehlərdə. *Ləpələr pıçıldaşır. – Şam ağaclarının yaşıl budaqları qürurla səslənib, bir-birilə öpüşür, pıçıldaşırdı.* S.Vəliyev. *Gülün üzü işıqlandı; Pıçıldaşdı çəmən, çiçək.* M.Dilbazi.

**PIÇILĞAN** *is.* *bayt.* Heyvanların diz və buzovluğunda dəmrov xəstəliyi. *Kəlbalı at ustalığı edər, pıçılğanı rahatca sağaldar*(*dı*). S.Rəhimov.

**PIÇILTI** *is.* Səs tellərinin iştirakı olmadan, yavaşca danışıq. [Rəhilənin] *pıçıltısı gətirdiyi xəbərin dəhşətini azaltmadı.* M.Hüseyn. *Ovçu ağlamsınmış bir pıçıltı ilə öz-özünə dilləndi.* M.Rzaquluzadə. // *məc.* Obrazlı təşbehlərdə. *Uzaqdan dərə sularının xəlvət pıçıltılara bənzəyən səsi gəlirdi.* Mir Cəlal.

**PIÇILTILI** *sif.* və *zərf* Pıçıltı ilə, yavaşcadan deyilən; pıç-pıç. *Pıçıltılı danışmaq. – ..Pıçıltılı, mehriban; məhrəm, tənhalıq dolu; xoş səsindən uzaqda; yalqızlıq içindəyəm.* R.Rza.

**PIÇ-PIÇ** *zərf* və *sif.* Yavaşcadan, pıçıltı ilə. *Pıç-pıç danışmaq*. – *Qonaqlar* [Sitarəyə] *zənn ilə baxıb, sonra anası ilə pıç-pıç danışdılar*. Çəmənzəminli. // Pıçıltılı, pıçıltılı danışıq. *Pıç-pıç başlandı.*

**PIXTALANDIRMA** "Pıxtalandırmaq"dan *f.is*.

**PIXTALANDIRMAQ** b a x **pıxtalaşdırmaq**.

**PIXTALANMA** "Pıxtalanmaq"dan *f.is.*

**PIXTALANMAQ** b a x **pıxtalaşmaq**.

**PIXTALAŞDIRMA** "Pıxtalaşdırmaq"dan *f.is*.

**PIXTALAŞDIRMAQ** *f.* Özlülüyünü artırmaq, qatılaşdırmaq, pıxtalandırmaq.

**PIXTALAŞMA** "Pıxtalaşmaq"dan *f.is.*

**PIXTALAŞMAQ** *f.* Özlüyü artmaq, qatılaşmaq, pıxtalanmaq.

**PIQQ** *təql*. Qaynayan qatı mayenin çıxardığı səs.

**PIQQAPIQ(LA)** *zərf* Pıq-pıq səs çıxararaq (qaynayan maye və ya qaynayıb çıxan su haqqında). *Səməni qazanı pıqqapıq qaynayırdı.* Mir Cəlal. [Bulaqların] *bəziləri daşların sinəsindən fışıltı ilə fəvvarə vurur, bəzisi isə pıqqapıqla sanki qaynaya-qaynaya çıxır*. Ə.Abasov.

**PIQQILDAMA** "Pıqqıldamaq"dan *f.is.*

**PIQQILDAMAQ** *f.* 1. Pıqqıltı səsi çıxarmaq, "pıq-pıq" etmək, yaxud "pıq-pıq" qaynamaq (maye haqqında). *Meşənin içindən çıxıb pıqqıldayan* (f.sif.) *bulaq şırhaşırla ağ çınqıllıq boyu aşağı axır*(*dı*). S.Rəhimov. *Arabanın üstündəki boçkanın ağzından sərin çeşmə suyu pıqqıldayaraq ətrafa səpələnirdi*. Q.İlkin.

2. Özünü saxlaya bilməyərək, səsini boğaraq gülmək. *Teymur ağa pərdənin dalısında gülməyini saxlaya bilməyib pıqqıldayır*. M.F.Axundzadə. *Kişi özünü saxlaya bilməyib, yavaşcadan pıqqıldadı*. Q.İlkin.

**PIQQILDAŞMA** "Pıqqıldaşmaq"dan *f.is.*

**PIQQILDAŞMAQ** *qarş.* Pıqqıldamaq (çoxları haqqında). *Qızlar Xasayı görüb, Durnaya baxaraq pıqqıldaşdılar*. Ə.Vəliyev. *Bu dəfə bütün dəstə pıqqıldaşıb gülüşdü*. İ.Hüseynov.

**PIQQILTI** *is.* 1. Mayenin qaynayarkən çıxardığı səs. *Közü qaraldıqca yaraşıqlı ağ samovar pıqqıltısını kəsərək yavaşımaqda idi.* M.İbrahimov.

2. Səsini boğaraq gülmə. *Onun bu hərəkətinə pıqqıltı ilə gülənlər də oldu*. M.Hüseyn.

**PIRÇIM-PIRÇIM** *zərf.*: **pırçım-pırçım tər tökmək** – çox işləməkdən, zora düşməkdən, istidən və s.-dən çox tərləmək, üz- gözündən damcı-damcı tər tökmək. *Xudakərəm .. o qədər özünə güc verərdi ki, iki-üç dəqiqə danışmamış pırçım-pırçım tər tökər, ağzı köpüklənər və boğulmağa başlardı*. S.Rəhimov.

**PIRILDAMA** "Pırıldamaq"dan *f.is.*

**PIRILDAMAQ** *f.* Qanadları ilə pırıltı səsi çıxararaq, "pırr" edərək uçmaq (quşlar haqqında). *Yolun altından bir dəstə göyərçin pırıldayıb qalxdı*. Ə.Vəliyev. *Quşlar pırıldayır kollar içindən; Uçub çəpərlərə qonur xoruzlar*. B.Vahabzadə.

**PIRILDAŞMA** "Pırıldaşmaq"dan *f.is.*

**PIRILDAŞMAQ** *qarş.* Qanadları ilə pırıltı səsi çıxararaq buradan oraya uçmaq (çoxlu quş haqqında). *Meşə xoruzları pırıldaşarkən; Durmuşdular hazır atların üstə.* H.K.Sanılı. *Hava işıqlaşanda kolluqlardan bildirçin, turac, kəklik pırıldaşıb qalxdıqca* [bəylər] *alıcı quşları buraxıb ovlayırdılar*. M.Rzaquluzadə.

**PIRILTI** *is.* Kiçik quşların qanad çalmasından çıxan səs. *Tula o saat özünü bildirçinin üstünə atdı. Bildirçin pırıltı ilə qalxdı.* S.S.Axundov. *Zəminin kənarındakı yaşıl otluqdan ürkmüş bir turac pırıltı ilə havaya qalxıb, ayrı bir yerə düşdü*. İ.Əfəndiyev.

**PIRPIZ** *sif.* Dik durmuş, vız durmuş. *Pırpız saç. – Cəfər güldü və əlini pırpız saqqalına uzatdı*. Çəmənzəminli. *Çal, pırpız qaşlarını qaldırıb* [Sultan] *gözlərilə gəlinə işarə etdi, qımışdı, hətta, deyəsən, köksünü də ötürdü*. İ.Hüseynov.

**PIRPIZLANMA** "Pırpızlanmaq"dan *f.is.*

**PIRPIZLANMAQ** *f.* Vız durmaq. *Qocanın seyrək saçları pırpızlanmışdı*. M.Hüseyn.

**PIRPIZLAŞMA** "Pırpızlaşmaq"dan *f.is.*

**PIRPIZLAŞMAQ** *f.* Pırpız olmaq, pırpızlanmaq. [Zakirin] *pırpızlaşmış* (f.sif.) *saçları onun üzünə daha xoş bir ifadə verirdi*. H.Seyidbəyli.

**PIRTLAQ** *sif.* Pırtlamış halda olan; pırtlamış, qabağa çıxmış. *Pırtlaq qarın. – Yusifin heybətli sifəti, qara və pırtlaq gözləri nəinki uşağı, hətta böyük adamı da qorxuya salırdı.* S.S.Axundov.

**PIRTLAMA** "Pırtlamaq"dan *f.is.*

**PIRTLAMAQ** *f.* 1. İrəli çıxmaq, qabarıb çıxmaq, qabarmaq. *Ağlamaqdan gözü pırtlamaq. Qarnı pırtlamaq.*

2. Dar bir yerdən dışarıya çıxmaq. *Yaralanan sol əli ilə başını düzəltdi və xəncəri müarizinin qarnına soxdu, piy pırtladı.* Çəmənzəminli.

3. B a x **pırtlaşmaq**. *Həqiqətin qırmızı yanağını toz basmış, başının tükləri bir neçə yerdən pırtlamış .. daş aşıran yoldaşlarına baxırdı.* Ə.Vəliyev.

**PIRTLAŞDIRMA** "Pırtlaşdırmaq"dan *f.is.*

**PIRTLAŞDIRMAQ** *icb.* Qarışdırmaq, pırtlaşıq salmaq, dolaşdırmaq, qarışdıraraq açılmaz hala salmaq. *İpliyi pırtlaşdırmaq.* – [Mirzə] *başının tüklərini pırtlaşdırıb, özünə bir laübalı sifət verib aynaya baxdı və dedi..* Ə.Haqverdiyev.

**PIRTLAŞIQ** *sif.* Pırtlaşmış halda olan; qarışmış, dolaşıq. *Pırtlaşıq sap. – Qarı əlini nəvəsinin pırtlaşıq və dolaşıq saçlarında gəzdirdi.* S.Rəhimov. ◻ **Pırtlaşıq düşmək** – 1) b a x **pırtlaşmaq**; 2) dolaşıq düşmək. *İşim pırtlaşıq düşüb.*

**PIRTLAŞMA** "Pırtlaşmaq"dan *f.is.*

**PIRTLAŞMAQ** *f.* Bir-birinə qarışmaq, dolaşmaq, pırtlaşıq düşmək, bir-birinə qarışaraq nizamsız hala düşmək. [Güləndam:] *Ağa sabahdan saqqalını daramayıbdır, pırtlaşıb barmaqlarına ilişir.* N.Vəzirov. [Arvadın] *saçları pırtlaşıb kilkələnmiş, üstü-başı parça-parça olmuşdu.* Ə.Vəliyev.

**PISPISA** *is. zool.* Peyinliklərdə, rütubət yerlərdə yaşayan qabığı bərk qara böcək. *..Saraydan enərkən çıxdı qarşıma; Pıspısa, süsəli, ya cırcırama.* Şəhriyar.

**PITRAQ** 1. *is. bot.* Kolluq və zibilliklərdə bitən ikiillik, yumru şəkildə olan üstü tikanlarla örtülü, dəydiyi şeyə yapışıb qopmayan ot-bitki. *Adi pıtraq. Pıtrağın bütün növləri alaq bitkisidir.*

2. *zərf* Çox sıx. *Pıtraq meyvə gətirmək. – ..Çəpərlərin diblərində balaca mavi çiçəklər pıtraq kimi qalxmışdı.* İ.Şıxlı.

**PİANİZM** [*ital.*] *mus.* Fortepianoda çalma məharəti, yaxud fortepiano musiqisinin səciyyəvi xüsusiyyəti.

**PİANÍNO** [*ital.*] Üfüqi çəkilmiş simləri olan hündür yeşik şəklində fortepiano növü. *Pianino çalmaq. – Salonun başında pianino dururdu, onun üstündə, divarda əlində gül, yarıçılpaq bir qadın təsviri asılmışdı.* M.İbrahimov.

**PİANİNOÇU** *is.* Pianino çalan musiqiçi.

**PİÁNO**[1] *is. dan.* Pianino. *..Qurbanlı toz basmış pianonun üzərində qoyulmuş köhnə çərçivələrə nəzər yetirdi.* Çəmənzəminli.

**PİANO**[2] *mus.* Çox yavaş, astadan (çalğı haqqında). *Bir yanda kağıza mən söz yazıram; Bir yanda sevgilim piano çalır.* S.Vurğun.

**PİANOÇU** b a x **pianinoçu**.

**PİÁSTR** *is.* [*ital.*] 1. Qədim ispan sikkəsi pesonun italyanca adı.

2. 1844 və 1916-cı illərdə Türkiyənin pul vahidi.

3. Misir, Suriya, Sudan və Livanın pul vahidi.

**PİÇ** *is.* [*fars.*] Vint. *Piçlə bağlamaq.*

◊ **Piçini burmaq** – əl-ayağını yığışdırmaq, özbaşınalığına son qoymaq. *Uşağın piçini burmaq.*

**PİÇBURAN** b a x **vintburan**.

**PÍFOS** *is.* [*yun.*] Antik dövrlərdə taxıl və başqa təsərrüfat ehtiyatlarını saxlamaq üçün böyük gil qab. *Egey pifosları. Yunan pifosları bəzəksiz olurdu. Pifosları yerə basdırırdılar.*

**PİJAMA** [*ing.* puyamaz] Xələt əvəzinə geyilən yüngül parçadan tikilmiş pencək və şalvardan ibarət yatmaq və ya ev paltarı. *Kişi pijaması. Qadın pijaması. – Kişi heç kəsə bir söz demədən o biri otağa keçdi. Zolaq-zolaq pijamasını geyinib hamama getdi.* İ.Şıxlı.

**PİK** [*fr.*] Sivriuclu dağ zirvəsi; formasından asılı olmayaraq dağ zirvəsinin ən yüksək nöqtəsi. *Qələbə piki.*

◊ **Pik saatı (vaxtı)** – nəqliyyatın, elektrik stansiyasının və s. ən gərgin iş vaxtı.

**PİKADÓR** *is.* [*isp.*] Korridada nizənin ucu ilə öküzü qıcıqlandıran, qəzəbləndirən atlı.

**PİKAP** *is.* [*ing.*] Sərnişin və yükdaşıyan, giriş qapısı arxadan olan kiçik avtomobil.

**PİKET** [*fr.*] Kiçik qarovul dəstəsi. // Tətil olan yerlərdə qarovul çəkən tətilçilər dəstəsi. *..Nərildəyən qatar bizik, nəfəs dərir piketlərdə.* X.Rza.

**PİKETÇİ** *is.* Piketdə iştirak edən adam.

**PİKTOQRAM** *is.* [*lat.* pictus – rənglə nəqş olunmuş və *yun.*] Şəkli yazı; qədim yazı növü.

**PİQMÉNT** [*lat.* pigmentum – rəng] *biol.* Orqanizmdə dəri və toxumalara rəng verən maddə. *Bitki piqmenti. Təbiətdə piqmentin yayılması. Fotobioloji proseslərdə piqmentin mühüm rolu var.*

**PİQMENTÁSİYA** [*lat.*] Heyvan və bitki orqanizmlərinin toxumalarında piqment rəng əmələ gəlməsi.

**PİLƏ** *is.* Baramadan alınan ipək. *Qaranlıq bir otaqda üzü qırışmış bir qarı oturub, pilə əyirirdi*. Çəmənzəminli. □ **Pilə kimi** – yum-yumşaq, ipək kimi yumşaq, incə, zərif. *Rüxsarənin pilə kimi yumşaq əlindən keçən soyuqluq Sübhanverdizadənin əsəblərinə yayıldı*. S.Rəhimov. *Sərvinaz qarı hirsli də olsa, pilə kimi yumşaq əllərini Yusifin böyründə, ətsiz qabırğalarının üstündə gəzdirdi*. B.Bayramov.

**PİLƏK** *is.* 1. Kiçik yastı düymə.

2. Boyunbağı, qolbaq və s.-də sallanan kiçik hissəcik. *Qolbağın piləyi. Qızıl pilək.*

**PİLƏKLƏMƏ** "Piləkləmək"dən *f.is.*

**PİLƏKLƏMƏK** *f.* Düymələmək, pilәkləri bağlamaq. *Donu piləkləmək*.

**PİLƏKLİ** *sif.* Üzərinə pilәklər tikilmiş, xırda yastı düymələrlə bəzədilmiş. *Keçən zaman vurardılar; Pilәkli pərdə qapıya.* M.Möcüz. *Qız başını qaldırdı, piləkli araqçını gördü*. Mir Cəlal.

**PİLƏQURDU** bax **baramaqurdu**.

**PİLƏMƏ** "Piləmək"dən *f.is.*

**PİLƏMƏK** *f.* Odu üfürüb alışdırmaq, yaxud nəfəsli musiqi alətlərini səsləndirmək üçün ağzını hava ilə doldurub püfləmək. *Birisi sacın altını gah piləyir, gah ətəkləyirdi*. Ə.Vəliyev. [Qız tumanı] *dartınanda açılan dizlərini şalı ilə örtərək peçi piləməyə başladı.* Ə.Əbülhəsən.

**PİLƏTƏ** *is.* [*rus.* плита] Üstündə xörək bişirmək və ya evi qızdırmaq üçün ağneftlə yanan fitilli cihaz; kerosinka. *Səriyyə pilətənin üstündəki xörəyi qarışdırmağa getdi*. M.Hüseyn. // Eyni məqsəd üçün işlədilən elektrik və ya qaz cihazı. *Elektrik pilətəsi. – Qaz pilətəsinin üstündə bozbaş qazanı qaynayırdı*. M.İbrahimov.

**PİLƏTƏÇİ** *is.* Pilətə təmir edən usta.

**PİLİK** *is.* Ocaq, tonqal və s.-ni yandırmaq üçün neft hopdurulmuş alışqan. *Əskidən pilik. Ocağın altına pilik qoymaq.*

**PİLLƏ** *is.* [*fars.*] 1. Pilləkənin çıxarkən və ya düşərkən ayaq qoyulan üfüqi hissələrindən hər biri. *Ləman ucadan gülüb, bir neçə pillə qalxdı və Teymura sarı döndü.* H.Seyidbəyli. // Cəm şəklində: **pillələr** – pilləkən. [Usta Ağabala] *..pillələr ilə aşağı endi və alçaq qapını taqqıltı ilə açıb girdi hamama*. Çəmənzəminli. *İşıqlı mərmər pillələrlə yer altına enirik..* M.İbrahimov. *Çatıb evə, pillələri; Birnəfəsə çıxır Reyhan*. M.Dilbazi. // *məc.* İnkişafın dərəcəsi, mərhələsi. *Təmərküzləşmənin yüksək pilləsi. – İnkişafın aşağı pilləsində olan bir xalqın təşkilatı dağınıq, ictimai həyatı naqis olur.* M.İbrahimov. // *məc*. Mərtəbə, səviyyə, dərəcə. *Yarməmməd çoxdan hesabdarlıqdan bir pillə yuxarı qalxmaq fikrində idi.* M.İbrahimov.

2. Hissə. *Raket bir neçə pillədən ibarətdir.*

**pillə-pillə** *zərf* 1. Pillələri bir-bir çıxaraq və ya düşərək. *Pilləkəni pillə-pillə çıxmaq.*

2. Mərtəbə-mərtəbə. *Qayalıqlı dağın ətəyində pillə-pillə salınmış kəndin bomboz evləri ətrafdakı boz qayalıqdan seçilmirdi.* M.Rzaquluzadə.

3. *məc.* Tədricən, yavaş-yavaş. *Ucalırıq pillə-pillə; Boy atırıq qarış-qarış*. B.Vahabzadə.

**PİLLƏKƏN** *is.* [*fars.*] Çıxmaq və düşmək üçün pillələrdən düzəldilmiş qurğu. *Daş pilləkən*. – [Yaşlı kişi:] *Pilləkənə açılan qapını açdıqda qarşımda qara ipək çarşaba bürünmüş, üzünü rübənd ilə örtmüş bir qadın gördüm*. S.Hüseyn. [Bəyim xala] *Canbalayevlərin pilləkəninin o biri tərəfində, eynən mənimki tək balaca bir otaqda olurdu.* İ.Hüseynov.

**PİLLƏLİ** *sif.* 1. Saylardan sonra gələrək, pilləkənin neçə pillədən ibarət olduğunu göstərir. *10 pilləli pilləkən.*

2. Bir neçə pillədən ibarət olan, pillələri olan. *Pilləli raket.*

**PİLÓT** [*fr.*] Uçucu aparatları idarə edən təyyarəçi. *Təklənmiş pilot quzğunların birini vurub yerə saldı.* M.Hüseyn. *O, bizim pilotlardır; Göz baxdıqca ucalır*. M.Seyidzadə.

**PİLOTÁJ** [*fr.*] Uçucu aparatları idarə etmə məharəti; təyyarə ilə manevr etmə. *Yüksək pilotaj*.

**PİLOTKA** [*rus.*] Əsgəri yay baş geyimi (ilk dövrlərdə ancaq pilotlarda). *..Pilotkalarını yanlarına atıb oturmuş üç əsgər söh-*

*bət edirdi.* Ə.Əbülhəsən. *Bir gün* [Azad] *pilotkasını yan qoymuş gözəl bir sanitarkanın yaralı gətirdiyini gördü*. S.Rəhman.

**PİLPİLƏ** *is. məh.* Palçıq vulkanı. *Ləpələrin üstündə; Əbədi neft qaynayan; Pilpilələr görmüş o!* İ.Səfərli.

**PİLTƏ** *is.* 1. Bəzi işıqlandırıcı və qızdırıcı cihazlarda (pilətə, lampa, şam və s.) yanan lent, ip, qaytan. *Lampaya piltə salmaq. Şamın piltəsini düzəltmək. – Məşədi bəy tez ayağa qalxdı, lampanın piltəsini qaldırdı*. M.Hüseyn. // Partlayış işləri apararkən alışqanı alışdırmaq və müəyyən məsafəyə ötürmək üçün qaytan; fitil. [İmamyar Türbətə:] *Dinamitin piltəsini ki gördün?* C.Cabbarlı.

2. *tib*. Qanaxmanı dayandırmaq və ya çirki sorub çəkmək üçün yaranın içinə, yaxud boşluğa qoyulan mikrobsuzlaşdırılmış tənzif (cuna) parçası; tampon. *Cərrah Səfərin yarasının piltəsini yenicə dəyişmişdi*. Çəmənzəminli.

**PİLTƏLƏMƏ** "Piltələmək"dən *f.is.*

**PİLTƏLƏMƏK** *f.* 1. Pilətə, lampa və s.-yə piltə keçirmək, piltə salmaq. *Lampanı piltələmək.*

2. *tib*. Yaraya və ya boşluğa piltə (tampon) qoymaq. *Yaranı piltələmək.*

**PİLYÁSTR** *is.* [*fr.*] Divarda şaquli çıxıntı.

**PİNC** *is. köhn.* Sınıq saxsı, çini və ya şüşə qabları yapışdırmaq üçün yumurta ağı, söndürülmüş əhəng və pambıqdan hazırlanan yapışqan. *Sayad dağda tor qurmaz; Qurub boynunu burmaz; Sınıq qaba pinc qoysan; Yenə gedər, su durmaz.* (Bayatı).

**PİNCLƏMƏ** "Pincləmək"dən *f.is.*

**PİNCLƏMƏK** *f. köhn.* Sınıq çini və ya şüşə qabı pinclə yapışdırmaq, pinc qoymaq. *Bankanı pincləmək*.

**PİNƏ** *is.* [*fars.*] 1. Yamaq (ayaqqabıda). ☐ **Pinə eləmək** – yamamaq. *Otur evdə, atanın eylə pinə çul-çuxasın*. C.Cabbarlı.

2. Döyənək. ☐ **Pinə bağlamaq** – döyənək olmaq. *İşləməkdən əli pinə bağlayıb. – Namaz qılmaqdan* [Şeyx İbrahimin] *alnı pinə bağlamışdı*. P.Makulu.

**PİNƏÇİ** *sif.* və *is.* Ayaqqabı təmir etməklə (pinəçiliklə) məşğul olan adam. [Qafar:] *Pinəçi Qafar tutduğu yerə kirə versin?* S.S.Axundov.

**PİNƏÇİLİK** *is.* Pinəçinin işi, sənəti, peşəsi. *..Bu altı nəfər müsəlmanın biri usta Cəfər Hacı İman oğludur. Bunun sənəti pinəçilikdir.* C.Məmmədquluzadə. *Mən o Şeyx Şabanı deyirəm ki, yolun qırağındakı Məhəllə məscidinin qabağında əyləşib pinəçilik edirdi.* Ə.Haqverdiyev.

**PİNƏKİ** *is. dan.*: **pinəki aparmaq (vurmaq)** – oturmuş halda huşa getmək, yuxu aparmaq, mürgüləmək, yuxuya getmək. *Yorğunluqdan pinəki vurur.*

**PİNƏLƏMƏK** *f.* Pinə etmək, yamamaq (ayaqqabını).

2. *məc.* Tez, başdansovma etmək.

**PİNİYA** *is.* [*lat.*] İynəyarpaqlı italyan küknar ağacı.

**PİNQ-PÓNQ** [*ing.* pinq-ponq] Stolüstü tennis.

**PİNQVİN** [*lat.* pingouin – yağlı] *zool.* Kürəyəoxşar qanadları olan, yaxşı üzən, lakin uça bilməyən iri Cənub qütb dəniz quşu.

**PİNSÉT** [pincette] bax **maqqaş** 1-ci mənada.

**PİNTİ** *sif.* 1. Üst-başına, təmizliyə, səliqə-sahmana fikir verməyən; əyin-paltarı, ya bədəni kirli, pasaqlı. *Pinti uşaq. – Qış getsə, gəlsə yaz; Pinti qız üzünü yumaz.* (Ata. sözü). *Əmi oğlu evə gələndə deyir ki, türk arvadları bircə qara quruşa dəyməzlər, özləri pinti, libasları yaraşıqsız, üstlərindən pis iy gəlir...* Ə.Haqverdiyev. // İs. mənasında. *Pintilər sırasına; Yazıldı onun adı*. M.Dilbazi.

2. *məc*. Səliqəsiz; təmiz iş görməyən.

**PİNTİLİK** *is.* Pinti adamın halı; kirlilik, səliqəsizlik. [Firəngiz:] *Bax, bu pintilik xəstəliyinə qarşı yürüş eləmək lazımdır.* B.Bayramov.

**PİÓN** *is.* Qaymaqçiçəklilər fəsiləsindən iri, qırmızı və ya ağ gülləri olan çoxillik bəzək bitkisi.

**PİONER**[1] *is.* [*fr.* pionnier – ilk yolaçan, bani, əsasını qoyan] 1. Birincilər sırasında olaraq hələ tanınmayan yeni bir ölkəyə daxil olmuş və orada məskən salmış adam.

2. *məc. kit.* Elm, mədəniyyət sahəsində yeni bir şeyin əsasını qoymuş adam; təşəbbüsçü. *Kosmos pionerləri. – Qori seminariyasının tələbələri və oranı bitirmiş müəllimlər*

*Şuşa teatrosunun birinci pionerləri olmuşlar.* Ə.Haqverdiyev.

**PİÓNER²** *is.* [*fr.*] Sovet dövründə: könüllü uşaq kommunist təşkilatının üzvü. *Gedir pionerin qızıl dəstəsi; Dağlara əks edir baraban səsi.* S.Vurğun.

**PİPÉT** [*fr.*] Gözə damcı və s. tökmək üçün rezin ucluq keçirilmiş şüşə borucuq.

**PİPİK** *is.* Bəzi quşların (məs.: xoruzun və bəzi toyuqların) başında olan qırmızı ət parçası, çıxıntı. *Qaraş ərik ağacının başına dırmaşmış beçənin qanlı pipiyinə baxıb "baş üstə" dedi.* M.İbrahimov.

**PİPİKLİ** *sif.* Pipiyi olan. *Pipikli toyuq. Pipikli quş.*

**PİR¹** *is.* [*fars.*] 1. Qoca, çox yaşlı kişi, ixtiyar. *Pirə ata dedim, cavana qardaş; Ana, bacı bildim qızı, gəlini.* Aşıq Ələsgər. [Buğac:] *Burada bihuş yatarkən, ağsaçlı, ağsaqqallı nurani bir pir – mənə meydanda ad verən o qoca – ozan gözümə göründü.* M.Rzaquluzadə. // Qoca adama müraciət. [Qurbanəli:] *Ey pir, daha səbrim tükənmiş.* S.S.Axundov.

2. Bir təriqət banisi və ya başçısı. // *məc.* Ustad, başçı, müəllim. *Qıraram dəstəni, vurram nəfəri; Ərənlərin piri yanımda gərək!* "Koroğlu". *Şair olan dərsi alır pirindən; Baş açmadım səgrəqibin sirrindən.* Qurbani.

◊ **(A) pir olmuş** – yarızarafat, yarıistehza ilə deyilən ifadə. [Rüstəm bəy:] *A pir olmuş, azarlı orada can verir.* S.S.Axundov. [Mustafa:] *Pir olmuş, nə edim, əsgərlikdir, bəxtəvərliyə göndərmirlər ki...* Ə.Məmmədxanlı.

**PİR²** b a x **ocaq** 3-cü mənada. *Şəhərdə böyük möcüzələr görünmüşdü: çoxlu ocaqlar, pirlər zühur etmişdi.* Çəmənzəminli. *Bakının ətrafındakı kəndlərin bir qismində bir çox pirlər, ocaqlar, ziyarətgahlar vardı.* H.Sarabski.

**PİRAMÍDA** [*yun.* pyramis, pyramidos] 1. *riyaz.* Oturacağı çoxbucaqlı və ya üçbucaqlı; yanları isə üçbucaqlı olan həndəsi cisim. *Dördbucaqlı piramida. Piramidanın yan üzləri.*

2. Qədim Misir fironlarının həmin şəkildə iri daşlardan qurulmuş çox nəhəng məqbərəsi.

3. Həmin şəkildə üst-üstə yığılmış (qalanmış) şeylər qrupu. *Bu taxta və sementi səhrada geodeziya piramidaları tikən inşaat briqadalarına göndərirlər.* Ə.Sadıq.

4. Sirkdə adamların bir neçə sıra bir-birinin üstündə durmasından ibarət gimnastik və ya akrobatik fiqur.

5. Bilyard oyununda: oyunun başlanğıcında üçbucaq şəklində düzülən şarlar. *Şarları piramida düzmək.*

**PİRAMİDÁL** *sif.* Piramida şəklində olan, piramidaya oxşayan.

**PİRAMİDKA** [*rus.*] Oxa keçirilən, getdikcə kiçilən müxtəlif rəngli halqalardan ibarət uşaq oyuncağı.

**PİRAMİDÓN** [*yun.* pur – od, am(moniakon) – qətranlı kitrə və eigos – şəkil] *əcz.* Ağrıkəsən və qızdırmanı salan dərman.

**PİRANİ** *sif.* [*fars.*] Qoca, ağsaqqal, ixtiyar, nurani. *Pirani kişi. – Qoca pirani bir kişi oturub qabağında manqal, əlində batman kitab.* (Nağıl). *Mən onu görmüşdüm pirani çağda; Uşaqdan da uşaq, uşaq kimiydi.* M.Araz. // Məc. mənada. *Bu nurani dünya, pirani dünya; Əzəldən meyvəli bir bağa bənzər.* Şəhriyar.

**PİRANİLİK** *is.* Qocalıq, ağsaqqallıq, ixtiyarlıq, nuranilik.

**PİRAT** [*lat.* əsli *yun.*] *tar.* Dəniz qulduru.

**PİRATLIQ** *is. tar.* Dəniz quldurluğu.

**PİRKEŞİK** *is.* [*rus.* "приказчик" sözünün təhrif olunmuş forması] 1917-ci il rus inqilabından qabaq: mağazada qulluq edən xidmətçi; satıcı. [Hacı Murad:] *Tacirbaşı Hacı Əlinin o zaman bir pirkeşiyi vardı.* S.S.Axundov. [Ana:] *Oğlum, səni öz dükanına pirkeşik götürür.* S.Rəhman.

**PİRLİK** *is.* Qocalıq, ağsaqqallıq, ixtiyarlıq; nuranilik, piranilik. *Pirlik etmişdi məni sərsəri; Qalmamışdı zövqü səfa əsəri...* Q.Zakir.

**PİROJKİ** [*rus.* "пирожок" söz. cəmi] *dan.* Kiçik piroq, balaca piroq. *Pirojki bişirmək. Ətli pirojki.*

**PİRÓJNA** [*rus.* пирожное] Adətən şirin iç (krem, badam və s.) qoyulmuş yağlı xəmirdən bişirilən şirniyyat məmulatı. *Kremli pirojna.*

**PİROKSİLÍN** [*yun.* pur – od və oxys – ağac] Partlayış işlərində və tüstüsüz barıt hazırlanmasında işlədilən partladıcı maddə.

**PİRÓQ** [*rus.*] Hər hansı bir şeydən iç qoyulmuş xəmir məmulatı. *Povidlo və riçal piroq və ponçik bişirmək üçün ən yaxşı şirnidir.*

**PİROTÉXNİK** [*yun.* pur – od və technike – bacarıq] Pirotexnika mütəxəssisi.

**PİROTÉXNİKA** [*yun.*] Texnikanın, alışqan xəlitələr, siqnal raketləri, fişəng və s. hazırlamaqla məşğul olan sahəsi.

**PİS** *sif.* 1. Mənfi keyfiyyət və ya xüsusiyyətlərə malik, verilən tələbləri təmin etməyən, istənilən kimi olmayan, mənfi təsir bağışlayan; yaman, fəna (*yaxşı* əksi). *Pis xörək. Pis xətt. Pis hava.* // Öz işini yaxşı bilməyən, təcrübəsiz. *Pis usta. Pis təşkilatçı.* // Ətrafdakılara yaxşı təsir bağışlamayan; kobud, qaba. *Pis xasiyyət*. – [Sənəm:] *İndi mən nə deyirəm ki, pis söz demirəm ki?!* Ü.Hacıbəyov.

2. Bəd, alçaq, rəzil, şərəfsiz, namərd. *Pis adam. Pis qonşu*. – [Əşrəf Zeynala:] *Xülasə, pis övlad gərək ortalıqdan götürülsün.* Çəmənzəminli. // Qeyri-əxlaqi, nalayiq, yaramaz, eyibli, nöqsanlı. *Pis hərəkət*. *Pis* (z.) *danışmaq*. *Özünü pis* (z.) *aparmaq*. // *İs. mənasında*. Pis adam. *Üz vermə nadana, sirr vermə pisə; Axır qəlbin ya inciyə, ya küsə*. Xəstə Qasım.

3. Əzici, üzücü, sıxıcı, ağır, mənhus, xoşagəlməyən. *Pis yuxu görmək. – Maralın vahiməsi Cumanı bəzən min cür pis fikrə, şübhəyə salırdı*. Ə.Əbülhəsən. // Mənfi. *Xəbər də, deyəsən, pis xəbər idi?* Mir Cəlal. *Ümid pis cavabı xəyalına gətirmək istəmirdi*. B.Bayramov.

◊ **Pis ağız** – söyüşkən, ağzıyava, ağzıpərtöv, hərzə adam haqqında. *Çox pis ağzı var. Pis ağzını açma!* **Pis göz** – bir şeyi gördükdə ona xətər yetirən, onu gözə gətirən adam haqqında. *Pis göz sənə dəyməz, gözəlim, xoş nəzərim var*. Ə.Vahid. **Pisinə gəlmək** – xoşuna gəlməmək, acığına gəlmək. [Musa:] *Doğrusu, mənim də pisimə gəldi, getmədim.* Ə.Haqverdiyev.

**PİSİKDİRMƏ** "Pisikdirmək"dən *f.is.*

**PİSİKDİRMƏK** *f. dan.* Qorxutmaq, vahiməyə salmaq, çaşdırmaq, ürkütmək. *Rüstəm kişi də məsələnin bu tərəfindən yapışıb* [Nəcəfi] *pisikdirdi.* M.İbrahimov. *Qumru istəyir ki, Babacanı pisikdirib, Bünyadı onun evindən çıxartsın, Bünyada özü getsin*. Ə.Əbülhəsən.

**PİSİKMƏ** "Pisikmək"dən *f.is.*

**PİSİKMƏK** *f. dan.* 1. Qorxmaq, vahiməyə düşmək, ürkmək. *Qaranlıqda pisikmək*.

2. İncimək, qəlbinə dəymək. *Yəhya Kamal pisikdi, küsdü, getdi*. Mir Cəlal.

**PİSKƏNDƏ** *is.* [*fars.*] *məc.* Qabığı soyulub qurudulmuş əncir. *Nənə isə əncirin qabıqlarını soyandan sonra sərib, piskəndə qurudardı*. H.Sarabski.

**PİSLƏMƏ** "Pisləmək"dən *f.is.*

**PİSLƏMƏK** *f.* Haqqında pis rəy, mənfi fikir söyləmək; pis hesab etmək. *Hərəkətini* (*işini*) *pisləmək.*

**PİSLƏNMƏ** "Pislənmək"dən *f.is.*

**PİSLƏNMƏK** *məch.* Haqqında pis fikir, pis rəy söylənmək, pis hesab edilmək. *Hərəkəti pislənmək. İşi pislənmək.*

**PİSLƏŞMƏ** "Pisləşmək"dən *f.is.*

**PİSLƏŞMƏK** *f.* 1. Getdikcə pis olmaq, keyfiyyətini itirmək, xarablaşmaq. *Məhsul pisləşib*.

2. Halı, vəziyyəti daha da xarab olmaq, daha da pis olmaq, ağırlaşmaq, kəskinləşmək, fənalaşmaq. *Getdikcə Məmməd sövdəgərin əhvalı pisləşirdi.* "Aşıq Qərib". *Almanlar əsirləri italyan torpağına gətirdikdə Məzlumun vəziyyəti daha da pisləşdi.* S.Vəliyev. // Maddi və ya mənəvi vəziyyəti getdikcə xarab olmaq, ağırlaşmaq. *Torpaqsız kəndlinin bəd idi falı; Pisləşirdi onun gün-gündən halı.* H.K.Sanılı.

**PİSLİK** *is.* 1. Pis şeyin hal və keyfiyyəti (*yaxşılıq* ziddi). *Yolun pisliyi. – Yüz min camaat içdiyi suyun yaxşılığı və pisliyini təbib əvəzinə molladan və hacıdan soruşuruq*. C.Məmmədquluzadə.

2. Pis iş, alçaqlıq, rəzillik, pis əməl, pis hərəkət; fənalıq. *Yetim diriləcək, Əzrailin pisliyi özünə qalacaq*. (Ata. sözü). *İnsanı pisliklərə sürükləyən bəlaların birisi və ən qorxulusu da şübhədir*. S.Vurğun. ☐ **Pislik etmək** – birinə qarşı pis iş görmək, alçaqlıq etmək, zərər vurmaq. [Oğlan:] *O mənə nə pislik edibdir və nə qəbahətin sahibidir ki, mən onu gorsuz-kəfənsiz qoyub gedim?* E.Sultanov.

**PİSNİYYƏTLİ** *sif.* Niyyəti, arzusu, istəyi, məqsədi yaxşı olmayan; qarafikirli.

**PİSNİYYƏTLİLİK** *is.* Niyyəti, məqsədi, arzusu, istəyi pis olma; qarafikirlilik.

**PİS-PİS** *sif.* b a x **pis** (çoxluq bildirir). *Pis-pis işlər. Pis-pis hərəkətlər. Pis-pis sözlər*. – [Mirpaşa:] *Mahmud qoşulub pis adamlara.* Z.Xəlil. [Sona xanım:] *Heç ürəyim bir dəqiqə sakit olmayır, başıma pis-pis fikir gəlir.* Ə.Haqverdiyev. // Zərf mənasında. *Pis-pis danışmaq*. – *Mühasib dişlərini qıcayaraq Sübhanverdizadəyə tərəf pis-pis baxıb qapını çaldı və çıxdı.* S.Rəhimov. *Mayis pis-pis altdan-altdan* [Tapdığa] *baxıb dəftərini istədi.* Ə.Vəliyev.

**PİSTOLÉT** [*fr.*] Tapança. *Zabit yerə yıxıldı, pistoleti əlindən düşdü*. S.Vəliyev. ◻ **Pistolet-pulemyot** – yaxın məsafələrə atmaq üçün sürətli avtomatik silah.

**PİSTÓN** [*fr.*] 1. Patronda barıtı alışdırmaq üçün partladıcı qalpaqcıq. *Patrona piston qoymaq*. *Pistonu nəmdən qorumaq*. // Oyuncaq tüfəng və tapançalar üçün içi barıtlı xırda kağız piləkcik. *Rəngarəng pistonlar*. // Nasosun içində maye və ya qazı sorub çəkən girdə hissəcik; porşen.

2. Nəfəsli mis musiqi alətlərində qapaqcıq.

**PİSTONLAMA** "Pistonlamaq"dan *f.is.*

**PİSTONLAMAQ** *f.* Piston qoymaq, piston salmaq. *Patronu pistonlamaq.*

**PİSTONLANMA** "Pistonlanmaq"dan *f.is.*

**PİSTONLANMAQ** *məch.* Piston qoyulmaq, piston salınmaq (patrona).

**PİSTONLU** *sif.* Piston qoyulmuş, piston salınmış; pistonu olan. *Pistonlu patron*.

**PİŞDƏRAMƏD** *is.* [*fars.*] *mus*. Muğamatda çalınan müqəddimə. *Segah pişdəramədi*.

**PİŞXİDMƏT** *is.* [*fars.* piş və *ər.* xidmət] *köhn.* Ev xidmətçisi, qulluqçu, nökər. *Yeni qonaqlar oturan kimi pişxidmət hazır oldu.* Çəmənzəminli. *Pişxidmət iki balaca fincanda tünd çay gətirdi*. M.İbrahimov.

**PİŞXİDMƏTBAŞI** *is. köhn.* Padşahların, hökmdarların sarayında baş xidmətçi. *Bu vaxt pişxidmətbaşı salona girib, aram addımlarla şaha yaxınlaşdı.* P.Makulu.

**PİŞİK** *is.* Pələng, şir və s.-nin də daxil olduğu fəsiləyə mənsub (vəhşi növləri də olan) məməli ev heyvanı. *Pişik öz balasını istədiyindən yeyər.* (Ata. sözü).

◊ **Pişiyə rast gələn (pişik görmüş) siçan kimi** – qorxaraq, dəhşətə gəlmiş halda, dəhşət içində. *Ənvər, pişik görmüş siçan kimi büzüşüb oturmuş, altdan-altdan gözünü Müşkünazın əlindəki konvertə zilləmişdi.* Ə.Vəliyev. **Pişiyimiz oğlan doğub!** – birinin olmuş bir şeyə qarşı istehza və kinayəsini bildirir. [Aslan Məzluma:] *Oho, lap qiyamətsən, pişiyimiz oğlan doğub.* S.Vəliyev.

**PİŞİKBAZ** *is.* Pişikləri çox sevən, çoxlu pişik saxlayan adam.

**PİŞİKOTU** *is. bot*. Kökündən dərman hazırlanan ot bitkisi; valeryan. *Pişikotu preparatları.*

**PİŞİM-PİŞİMLƏ** *zərf* Mehribanlıqla, oxşaya-oxşaya, acıqlandırmadan, dilə tutaraq. *Mahmud pişim-pişimlə ürgəni yedəkləyib, yenə bulağın qırağına gətirəndə Minarə nə üçünsə bayaqkı maralları xatırladı*. M.Hüseyn. [Koxa:] *Tutmağa çalışdım bunları dilə; Yola gəlmədilər pişim-pişimlə*. S.Rüstəm.

**PİŞNAMAZ** *is.* [*fars.*] *din.* Məsciddə namaz qılanların qabağında duraraq namaz mərasimini idarə edən ruhani. *Sonra* [molla] *qabağında duran pişnamaza bir kəllə vurub yerə yıxır*. "M.N.lətif." *Bu vaxt pişnamaz gəlib zöhr – günorta, əsr namazını qılardı.* H.Sarabski.

**PİŞ-PİŞ** *təql.* Pişiyi çağırmaq üçün çıxarılan səs. *Nə qədər piş-piş elədim, pişik gəlmədi*.

**PİŞPİŞİ** *is. bot*. 1. Tərkibində "C" vitamini olan, toxumlarının hər iki tərəfi seyrək tüklərlə örtülü birillik ot-bitki.

2. Uşaq dilində: pişik.

**PİŞRAZ** *məh*. [*fars.* pişrəst] *sif.* Tezyetişən, tezdəyən. *Pişraz üzüm. Pişraz tut.*

**PİŞROV** *sif.* [*fars.*] *köhn.* İrəlidə gedən, öndə olan, qabaqcıl.

**PİŞTAXTA** *is.* [*fars.*] Mağazada, dükanda satıcı ilə alıcını bir-birindən ayıran, üstündə mal göstərilən və buraxılan, qabaq tərəfi bağlı uzun stol. [Əmirmərduq:] *Dərzi malı piştaxtanın üstünə qoyub açdı, qayçını götürdü və birdən bir şərqi oxudu.* Çəmənzəminli. *İlyas piştaxtanın üstündən əyilib, divardakı paltarlara diqqətlə baxdı.* Mir Cəlal. // Bazarda, bufetdə və s.-də üstündə şey satmaq üçün xüsusi stol. *Göyərtini piştaxtanın üzərinə düzmək*.

**PİŞTO(V)** *is. dan. köhn.* Tapança. [Əsgər:] *Çıxardın piştovları, hazır olun!* Ü.Hacıbəyov.

*Mən ömrümdə bir dəfə də pişto atmamışam.* M.Hüseyn.

**PİŞVAZ** *is.* [*fars.*] Gələn adamı qarşılama, qabağına çıxma. *Hədiyyə də pişvaza gələnlər içərisində idi*. Mir Cəlal. ◻ **Pişvaz etmək** – gələn adamı qarşılamaq, qabağına çıxmaq. *Mən qonaqların qabağına çıxıb sidqi-ürəkdən onları pişvaz edirdim.* C.Məmmədquluzadə. *Aşıq Cəlal qoca ustadını böyük bir hörmət və sevinclə pişvaz etdi*. Ə.Məmmədxanlı. **Pişvaza çıxmaq** – b a x **pişvaz etmək**. *Atası oğlunun gəlmək xəbərini eşidib pişvaza çıxdı*. (Nağıl). [Hacı Nəsir:] *Gülpəri .. gərək sənin pişvazına çıxılaydı, şadlıq olunaydı*. S.S.Axundov.

**PİTİ** *is.* Hər adam üçün ayrı-ayrı güvəclərdə bişirilən bozbaş. *Piti bişirmək*. – [Ümid:] [Hətəmovun] *yağlı pitisi olmasa, canı dinclik tapmaz.* B.Bayramov.

**PİTİK** *is. köhn.* 1. Yazı, kitab, sənəd.

2. Yazılmış dua, yazılı dua, ümumiyyətlə dua. [Kəndli:] *Sən Allah, buna bir duadan, pitikdən yaz*. "M.N.lətif." // *köhn*. Dəri, əsgi və s.-nin içinə qoyulub ev heyvanlarının boynundan, buynuzundan asılan dua. *Ağ qoçların boyunlarından ara-sıra gözmuncuğu və yaşıl meşindən tikilmiş içidualı üçkünc pitik asardılar.* H.Sarabski.

**PİVƏ** *is.* [*rus.* пиво] Arpa səmənisindən hazırlanan azspirtli köpüklü içki. *Pivə mayası. Mayaotu pivəyə xarakterik və acıtəhər dad verir*. – [İlyas:] *Mənə də iki stəkan pivə verdilər, içdim.* Ə.Məmmədxanlı.

**PİVƏXANA** *is.* [*rus.* пиво və *fars.* ...xanə] Pivə satılan yer, dükan.

**PİY** *is.* Heyvan bədənində toplanıb yığılan yağ maddəsi və onun əridilmiş halda olan məhsulu. *Mal piyi. Keçi piyi. – Ruzgar ancaq piydən qayrılmış şamları söndürə bilər.* C.Cabbarlı. // İnsan bədənində yağ maddəsi. ◻ **Piy bağlamaq (basmaq)** – çox kökəlmək. [Şərəfoğlu] *indi də iyirmi il əvvəlki kimi, yaraşıqlıdır, nə qarnı piy bağlayıb, nə də boynunu, buxağını ət basmışdır*. M.İbrahimov.

**PİYADA** [*fars.*] *zərf* 1. Miniklə deyil, ayaqları ilə. *Piyada yola düşmək. Piyada yollanmaq. – Faytonu xanım bir az kənarda saxlatdı, qapıya qədər piyada getmək istədi*. Çəmənzəminli. [Səkinə:] *Yox, Ələbbas, sən sür, mən piyada gedəcəyəm.* H.Seyidbəyli.

2. *sif.* Ayaqla gedilən, ayaqla icra edilən. *Piyada marş. Piyada kross*.

3. *is.* Miniklə yox, öz ayaqları ilə gedən adam. *Piyadalar üçün keçid. Küçədə piyadaların gediş-gəlişini tənzim etmək. – Sən atlısan, mən piyada; Öldürəcək bu qəm məni!* Aşıq Ələsgər.

4. *is.* Piyada hərəkət edən və döyüşən qoşun növü. *Piyadada xidmət etmək.* // *is.* Həmin qoşun növündə xidmət edən əsgər. *İrəlidə piyadalar çarpışır*. H.Nəzərli. *Piyadalarımız Üçtəpəyə iki kilometr qalmış dayandı.* Ə.Vəliyev.

5. *is*. Şahmat oyununda dəyərcə ən aşağı fiqur. *Piyada ilə oyuna başlamaq. Piyadanı uduzmaq. – Şahmatda hər bir oyunçunun bir şahı, iki vəziri, iki topu, iki fili, iki atı və səkkiz piyadası olur.*

6. *məc. sif.* Kəmsavad, azsavadlı, bilik cəhətdən çox kasıb. *Piyada adam*. – [Xəlil Şahmara:] *Yaxşı, yaxşı, elə sən də mənim kimi piyadasan, çox da qürrələnmə.* M.Hüseyn.

◊ **Piyada çəyirtkə** *zool.* – adi çəyirtkədən kiçik, qanadsız çəyirtkə.

**PİYADAÇI** b a x **piyada** 3 və 4-cü mənalarda. *Piyadaçı əsgər. – Piyadaçılar iyirmi kişi olardılar*. S.Hüseyn.

**PİYADALANMA** "Piyadalanmaq"dan *f.is.*

**PİYADALANMAQ** *məch.* Atdan və s.-dən düşüb piyada getmək. [Adil və Aqil] *bir ehtiram və üzr əlaməti olaraq, atdan düşüb piyadalandılar*. S.Rəhimov.

**PİYADALIQ** *is.* 1. Piyada olma; piyadanın vəziyyəti. *Piyadalıq dəliləri əldən-dildən saldı.* "Koroğlu".

2. *məc.* Biliksizlik, məlumatsızlıq, bilik cəhətdən kasıblıq.

**PİYALƏ** *is.* [*fars.*] Ağzı gen, dibi dar balaca içki qabı; qədəh. *Su piyaləsi*. – [Pəri Cadu:] *Doldur piyaləni, anadan olandan indiyə kimi mən belə kefi görməmişəm.* Ə.Haqverdiyev. *Hamı bir ağızdan* "*urra*" *deyib piyalələri qaldırdılar.* Ə.Vəliyev. // Həmin qabın çay içmək üçün olan növü. *Piyaləyə çay tökmək*. // Müxtəlif obrazlı təşbehlərdə. *Sözləri qənd, ağızları piyalə; Şəkər əzmiş dilə, dodağa qızlar*. M.P.Vaqif. *Qaşının tağında piyalə gözlər; Yeni ay qoynunda ulduza bənzər.* A.Şaiq.

**PİYALƏGÖZ(LÜ)** *sif.* Gözləri iri və girdə. *Piyaləgöz qız. – Biri qara dedi, biri alagöz; Bu, ceyrangöz dedi, o, piyaləgöz.* R.Rza.

**PİYAN** [*rus.* пьяный] *dan.* Sərxoş, kefli. *Adam var anlamır, danışır sözün; İçməmiş piyandı, itirib özün.* Aşıq Ələsgər. ☐ **Piyan olmaq** – içib keflənmək, sərxoş olmaq.

**PİYLƏMƏ** "Piyləmək"dən *f.is.*

**PİYLƏMƏK** *f.* Müalicə və b. məqsədlərlə bədənə və ya onun bir yerinə piy sürtmək, piy çəkmək. *Uşağı piyləmək. – Ballı xala keçi piyi axtarırdı ki, Qulunu piyləsin.* Çəmənzəminli.

◊ **Başını piyləmək** – b a x **baş**.

**PİYLƏNDİRMƏ** "Piyləndirmək"dən *f.is.*

**PİYLƏNDİRMƏK** *f.* Kökəltmək. ☐ **Qarnını (göbəyini) piyləndirmək** – çoxlu yağlı, qidalı şeylər yeyərək kökəlmək. [Paşa bəy Fərruxa:] *Mən sənə ümidəm, sən də göbəyini piyləndirməkdən başqa heç nəyə fikir vermirsən.* Ə.Vəliyev.

**PİYLƏNMƏ** 1. "Piylənmək"dən *f.is.*

2. Kökəlmə. *Ev heyvanlarının piylənmə; yetişmə meyli bol yemlənmənin nəticəsidir.* "Ümumi zootexniya".

3. Həddən artıq kökəlməkdən ibarət xəstəlik halı. *Piylənmənin qarşısını almaq.*

**PİYLƏNMƏK** 1. *məch.* Piy sürtülmək.

2. *qayıd.* Çox kökəlmək. *Erkəklər piyləndi.*

**PİYLƏŞMƏ** "Piyləşmək"dən *f.is. Alkoqolun təsirindən ürək əzələlərində piyləşmə əmələ gəlir ki, bu da fiziki işlə məşğul olmaq üçün çətinlik törədir.*

**PİYLƏŞMƏK** b a x **piylənmək** 2-ci mənada.

**PİYLİ** *sif.* 1. Kök, piyi olan. *Piyli qoyun.*

2. Yağlı, çox piyi olan. *Piyli ət.*

3. Tərkibində piy olan, piy vurulmuş. *Piyli məlhəm.*

4. *məc.* Şişman, kök, yekə, piy basmış. *Piyli göbəyini qabağa verib, hətta özünü günahkar sayardı.* B.Bayramov. *Gəl indi inan ki, onun ürəyi; Piyli mədəsinin içində deyil.* O.Sarıvəlli.

**PİYLİLİK** *is.* 1. Köklük, köklük dərəcəsi. *Keçinin piyliliyi.*

2. Yağlılıq, yağlılıq dərəcəsi. *Ətin piyliliyi.*

**PİYSİZ** *sif.* 1. Arıq, piyi olmayan. *Piysiz quzu.*

2. Yağsız, yavan. *Piysiz ət.*

**PİYSİZLİK** *sif.* Yağsızlıq, arıqlıq, yavanlıq. *Ətin piysizliyi.*

**PLAFÓN** *is.* [*fr.*] Tavana və ya divara bərkidilmiş elektrik lampaları örtüsü.

**PLAGİAT** [*lat.* plagium – oğurlanmış] Başqasının əsərini öz əsəri kimi vermə və ya müəllifi göstərilmədən başqasının əsərindən istifadə etmə; ədəbi oğurluq.

**PLAGİATOR** [*lat.*] Plagiatla məşğul olan adam.

**PLAGİATORLUQ** *is.* Plagiatla məşğul olma (b a x **plagiat**).

**PLAKAT** [*lat.* placatum – şəhadətnamə] Küçə və ya ictimai yerlərdə təbliğat, məlumat və ya reklam məqsədi ilə asılan qısa mətnli iri şəkil, böyük elan. *..Göy rəngli qapının sağ tərəfində iri plakat asılmışdı. Qaçay bu plakatı, oradakı maşın, pianino, motosiklet şəkillərini əvvəllər də görmüşdü.* İ.Məlikzadə.

**PLAKATÇI** *is.* Plakat çəkən rəssam. *Plakatçıların sərgisi.* // Sif. mənasında. *Plakatçı rəssamlar.*

**PLAN** [*lat.* planus – səth] 1. Bir şeyin (yer, tikinti, qurğu və s.-nin), tənasübləri saxlanılmaqla müəyyən masştabda kağız və s. üzərində göstərilən cizgisi. *Binanın planı. Şəhərin planı.* – [Cinayətov] *ayağa qalxıb, divardan asılan planın qabağına getdi.* Mir Cəlal.

2. Bir işin nə qaydada, nə kimi ardıcıllıqla və hansı müddətlərdə yerinə yetiriləcəyini və s. qabaqcadan nəzərdə tutan tədbirlər sistemi. *Xalq təsərrüfatının inkişaf planı. İstehsalat planı. – Beşillik planı iki il yarımda yerinə yetirdik.* M.Müşfiq.

3. Nəzərdə tutulan, təxmin edilən şey; fikir, niyyət, təxmin, fərziyyə. *Səfərimizin planı. Səyahət planı. Hərəkət planı.*

4. Bir şeyin şərhində müəyyən qayda və ardıcıllıq. *Dərsin planı. Elmi əsərin planı.*

5. Hər hansı bir şeyin perspektivdə (gələcəkdə) nəzərdə tutulan mövqeyi. ☐ **...planda** *məc.* – 1) bir şəxsin, ya şeyin əhəmiyyətinə, vacibliyinə, lazımlığına görə tutduğu, ya tutacağı mövqeyi, yeri göstərir. *Planda duran məsələlər;* // kinoda şəkillərin böyük, ya kiçik masştabda verilməsi. *Şəkli orta planda vermək. Aktyorun surəti böyük planda verilmişdir;* 2) nöqteyi-nəzərdən, baxımdan. *Əsəri*

*nəzəri planda müzakirə etmək. – M.F.Axundzadə komediyaları böyük ictimai məsələləri əhatə edən, komik, planda ictimai xarakterlər yaradan klassik komediya əsərləri idi*. M.İbrahimov.

◊ **Plan tökmək (qurmaq, çəkmək)** – niyyətini; arzusunu, məqsədini həyata keçirmək üçün yollar, vasitələr, üsullar, tədbirlər düşünmək. *Ondan da dövlətlisini taparam, – deyə Əhməd özünə plan qururdu.* B.Talıblı. *Qaçaqlar oturub, çəkirlər plan; Qozluğun lap içi olacaq meydan*. H.K.Sanılı. *Məsum kişi .. möhkəm bir plan tökmüşdü*. Mir Cəlal.

**PLANÉR** [*fr.*] Yuxarıya qalxan hava axınının köməyi ilə havada süzən motorsuz uçucu aparat.

**PLANERÇİ** *is.* Planerçiliklə məşğul olan idmançı; planer pilotu. *Bu vertolyotlardan əllərində çiçək dəstələri olan təyyarəçi, planerçi və paraşütdən qızlar düşdülər.* (Qəzetlərdən).

**PLANERÇİLİK** b a x **planerizm**.

**PLANERİST** [*fr.*] b a x **planerçi**. [Reyhan:] *Bir dəfə Şamxordan, planeristlər yarışından bizi Bakıya apardılar*. Mir Cəlal.

**PLANERÍZM** [*fr.*] Planerlərdə uçmaq işi, planer idmanı ilə məşğul olma.

**PLANERODROM** [*fr.* planeur və *yun.* dromos] Planerlərin durması və qalxması üçün meydança.

**PLANÉT** [*yun.* planetes – dolaşan] Günəşin ətrafında fırlanan və Günəş işığının inikası ilə işıqlanan göy cismi; səyyarə. *Böyük planetlər. Mars planeti. – Görəcəksiniz, Aya, Marsa və ya başqa planetlərə ilk ayaq basanların birincisi bizim bu təyyarəçilər olacaqlar.* Mir Cəlal. // Dünya, Yer, Yer kürəsi, Yer üzü. *Bütün planetdə insanlar bir-birinə yoldaşdır. Bizim planetimiz – Yer təxminən 3 milyard il bundan əvvəl əmələ gəlmişdir.*

**PLANETARİ** [*yun.*] 1. Qübbəvari ekranda planet və başqa göy cisimlərinin yerini və hərəkətini göstərən cihazlar sistemi, qurğu.

2. Belə qurğu vasitəsilə planetlərin yeri və hərəkəti nümayiş etdirilən xüsusi bina. *Moskva planetarisi*.

**PLANLAMA** "Planlamaq"dan *f.is.*

**PLANLAMAQ** *f. dan.* Planını çəkmək, planını almaq, planlaşdırmaq.

**PLANLAŞDIRILMA** "Planlaşdırılmaq"dan *f.is.*

**PLANLAŞDIRILMAQ** *məch.* Planı alınmaq, planı çəkilmək, planı tərtib edilmək. [Şirzad:] *Məhsuldarlıq planlaşdırılarkən bütün imkanlarımız nəzərə alınmamışdır.* M.İbrahimov.

**PLANLAŞDIRMA** "Planlaşdırmaq"dan *f.is.*

**PLANLAŞDIRMAQ** *f.* 1. Tikinti, qurğu və s.-nin planını və ya layihəsini tərtib etmək, hazırlamaq, planlamaq. *Binanı planlaşdırmaq*.

2. Plana, çertyoja əsasən düzəltmək, yerləşdirmək; bir şeyin çertyoja, plana əsasən qurulması, yerləşdirilməsi üçün yer ayırmaq. *Parkı planlaşdırmaq*.

3. Hər hansı bir tədbirin, işin və s.-nin gedişi, inkişaf etdirilməsi planını tərtib etmək. *Yaz tarla işlərini planlaşdırmaq.* // Bir işin həyata keçirilməsi, başa çatdırılması üçün plan üzrə vaxt təyin etmək. *Ekspedisiyanı may ayına planlaşdırmaq. İşin bitməsi, cümə gününə planlaşdırılmışdır.*

**PLANLI** *sif.* Əvvəlcədən müəyyənləşdirilmiş plana əsasən həyata keçirilən, plan üzrə olan. *Planlı təsərrüfat. Planlı təchizat. Planlı tikinti.*

**PLANLILIQ** *is.* Bir şeydə plan olması, bir şeyin plana tabe olması; müntəzəmlik, sistemlilik, mütəşəkkillik.

**PLANSIZ** *sif.* Əvvəlcədən müəyyənləşdirilmiş plana əsaslanmayan, plan üzrə olmayan, plana tabe olmayan. *Plansız tikinti*. // Sistemsiz, qeyri-müntəzəm, qeyri-mütəşəkkil. *Plansız* (z.) *işləmək*.

**PLANSIZLIQ** *is.* Planın olmadığı hal, plana uyğun gəlməmə, plan üzrə olmama; qeyri-müntəzəmlik, qeyri-mütəşəkkillik. *Ən geridə qalan bu manqanın zəif cəhətləri intizamsızlıq, qeyri-mütəşəkkillik, plansızlıqdır*. Ə.Vəliyev.

**PLANŞÉT** [*fr.*] 1. *geod.* Çertyoj kağızını sərib üstündə işləmək üçün dördbucaq xüsusi taxta lövhə. *Planşetlərin qar kimi ağ üzündə incə xətlərlə müxtəlif işarələr çəkilməyə başlanmışdı*. Ə.Əbülhəsən.

2. *geod.* Geodezik planaalma nəticəsində tərtib olunmuş plan. *Sahənin planşeti*.

3. Xəritə qoymaq üçün şəffaf yastı çanta. *Xəritəni planşetə qoymaq*.

**PLANTÁSİYA** [*lat.* plantatio – əkin] 1. Müəyyən kənd təsərrüfatı məhsulu (məs.: şəkər qamışı, pambıq, çay, qəhvə və s.) yetişdirmək sahəsində ixtisaslaşmış iri kapitalist əkinçilik təsərrüfatı.

2. Xüsusi kənd təsərrüfatı bitkisi əkilmiş iri torpaq sahəsi; tarla, zəmi. *Çay plantasiyası. – Ağacların qalın gövdələri arasından yaşıl tütün plantasiyası görünür, çöldə işləyən qızların mahnısı ucalırdı*. H.Seyidbəyli.

**PLANTÁTOR** [*lat.*] Plantasiya (1-ci mənada) sahibi.

**PLASKÁRT** [*alm.*] 1. Sərnişinə vaqonda nömrələnmiş yeri tutmaq hüququ verən sənəd.

2. *dan.* b a x **plaskartlı** 2-ci mənada. *Plaskart vaqon*.

**PLASKARTLI** *sif.* 1. Plaskartı olan. *Plaskartlı bilet*.

2. Plaskart üzrə sərnişinə verilən. *Plaskartlı yer*.

**PLÁSTIR** *is.* 1. Dərmanlı parçadan lent, məlhəm.

2. Dərinin deşilmiş yerini tutmaq üçün müvəqqəti yamaq.

**PLASTİK** [*yun.*] 1. "Plastika"dan *sif. Plastik incəsənət* (*heykəltəraş*). // Xarici həcmi, formanın həmahəngliyi, müntəzəmliyi, ifadəliliyi ilə əlaqədar olan. *Plastik təsvir*.

2. İncə, müntəzəm, gözəl (b a x **plastika** 3-cü mənada). *Plastik hərəkətlər*.

3. Təzyiq altında hər cür şəkil alan və bundan sonra da həmin şəkli saxlama xüsusiyyətinə malik olan. □ **Plastik kütlə** – qızdırıldıqda asanlıqla müəyyən forma alan, sonra isə həmin formanı saxlaya bilən süni və ya təbii material.

4. *tib*. Dəri və ən yaxın dərialtı toxumaların sağlam yerdən xəstə yerə köçürülməsi ilə əlaqədar olan. *Plastik operasiya*.

**PLASTİKA** [*yun.* plastike] 1. *inc*. Heykəltəraşlıq sənəti. *Antik plastika. Plastika məktəbi*. // Heykəltəraşlıq əsərləri.

2. *inc*. b a x **plastiklik**. *Heykəlin plastikası*.

3. Bədənlə ritmik zərif hərəkətlər göstərmə məharəti. *Balet icraçıdan plastika tələb edir*.

**PLASTİKLİK** *is.* 1. Qəşənglik, zəriflik, ahəngdarlıq, vəznlilik. *Hərəkətin plastikliyi. Heykəlin plastikliyi*. – "*Rənglilər rəqsi*" *musiqi və rəqsin plastikliyi cəhətdən çox zəngindir*. S.Hacıbəyov.

2. Yoğurula bilmə, istənilən şəklə salına bilmə.

**PLASTİLÍN** [*yun.* plastos] Heykəltəraşlıqda işlədilən gildən və ya mumdan hazırlanmış qurumayan plastik kütlə.

**PLASTÍNKA** [*rus.*] 1. Səs yazılmış patefon və ya qrammofon valı. *Plastinka hərləndi, qız nəşə ilə yerindən sıçrayıb, Aslana tərəf yüyürdü və hamar, parlaq parket üzərində süzməyə başladılar*. C.Cabbarlı.

2. Fotoaparatda şəkil çəkmək üçün işığa həssas emulsiya ilə örtülmüş şüşə. *Fotoqraf bundan özünü itirdi və plastinka qutusu əlindən yerə düşdü*. Q.İlkin.

**PLAŞ** [*rus.* плащ] Yağmurdan qorunmaq üçün sukeçirməyən materialdan tikilmiş paltoya oxşar enli üst geyimi; bürüncək, yağmurluq. *Tərlan əlini plaşının cibindən çıxartmayıb, Mürsəl kişinin yanındaca maşına söykəndi*. M.Hüseyn. *Əynində plaş olan bir adam evin qapısını döydü*. Q.İlkin.

**PLAŞ-ÇADIR** *is.* Həm plaş, həm də çadır kimi istifadə oluna bilən sukeçirməyən plaş. *Zəhra yaralını plaş-çadırın arasına qoydu*. Ə.Vəliyev.

**PLATFÓRMA** [*fr.*] 1. Möhkəm materialla örtülü hündür, düz meydança, səki. *Zenit topunun platforması*. // Stansiyada dəmiryol yatağı boyunca düzəldilmiş belə meydança, səki. *Vağzalın platformasında bir neçə nəfər adam görünürdü*. S.M.Qənizadə. [Stansiyada] *zəif surətdə işıqlanmış platformada yuxulu sərnişinlər o yan-bu yana qaçırdılar*. T.Ş.Simurq. // Kiçik dəmiryol stansiyası; yarımstansiya.

2. Alçaq bortlu üstüaçıq yük vaqonu. *Təknənin alt qapağı açılaraq torpaq platformaya boşalırdı*. Ə.Sadıq. *Açıq platformalarda gümüş rəngli kabel muftaları düzülmüşdü*. H.Seyidbəyli.

3. *məc.* Hər hansı partiya və qrupun fəaliyyət proqramı, məramı, siyasi tələbləri. *Partiyanın seçki platforması*.

**PLATÍN** [*isp.* platina] Boz, ağ rəngli qiymətli metal; ağqızıl.

**PLATÓ** *is.* [*fr.*] Aşağısı sıldırımlı olan düzənlik.

**PLATONİK** *sif.* [*xüs. is.*-dən] 1. Platonizm fəlsəfəsi ilə əlaqədar olan.

2. Bax **əflatuni**. *Əsrlərdən bəri mistik dona geydirilmiş platonik eşqə qarşı poeziyaya bir növ epikürizm gəlir*. M.İbrahimov.

**PLATONÍZM** [*xüs. is.*-dən] Qədim yunan filosofu Platon və onun ardıcıllarının idealist fəlsəfəsi.

**PLÁZMA** [*yun.* plasma] *biol.* Qanın maye hissəsi.

**PLEBÉY** [*lat.*] *tar.* Qədim Romada: şəxsən azad, lakin əvvəllər heç bir siyasi hüquqa malik olmayan aşağı təbəqələrə mənsub adam.

**PLEBİSSİT** [*lat.* plebiscitum – xalqın qərarı] Ümumxalq rəy sorğusu; referendum.

**PLENÁR** *sif.* [*lat.* plenarius – tam] Hər hansı bir təşkilatın seçilmiş rəhbər orqanının bütün üzvlərinin iştirakı ilə olan, keçirilən. *Plenar iclas*.

**PLÉNUM** [*lat.* plenum – tam] Plenar iclas. *Plenumun qərarları*.

**PLÉVRA** [*yun.*] *anat.* Ağciyər və döş boşluğunun divarını örtən pərdə.

**PLEVRÍT** [*yun.*] *tib*. Plevranın iltihabı.

**PLİTƏ** [*rus.* плита] 1. İri, yastı səthi düz daş, metal və s. parçası. *Mərmər plitə. Beton plitə. Çuqun plitə*.

2. Bax **pilətə**. *Qaz plitəsi*.

**PLİTKA** [*rus.*] 1. Kiçik plitə (bax **plitə** 1-ci mənada). *Keramika plitkası*. // Bir şeyin kiçik, yastı, dördbucaqlı parçası. *Şokolad plitkası*.

2. Bax **pilətə**. *Elektrik plitkası*.

**PLOMB** [*lat.* – qurğuşun] 1. Bağlanmış qapılara, qablaşdırılmış mallara, qapalı qutulara və s.-yə asılan, üzərinə damğa basılmış qurğuşun və ya başqa materialdan hazırlanmış möhür növü. *Qutuya plomb vurmaq*.

2. Dişdəki oyuğu doldurmaq üçün işlədilən, sonradan bərkiyən xüsusi maddə. *Dişə plomb vurmaq. Dişin plombu düşmüşdür.*

**PLOMBİR¹** [*coğr. addan*] Qaymağa meyvə, şirə və s. qatılmaqla hazırlanan dondurma növü.

**PLOMBİR²** [*lat.*] Bağlı qapılara, mallara plomb vurmaq üçün alət.

**PLOMBLAMA** "Plomblamaq"dan *f.is.*

**PLOMBLAMAQ** *f.* 1. Bağlı qapılara, mallara plomb vurmaq. *Vaqonu plomblamaq. Malı plomblamaq. Kassanı plomblamaq*.

2. Plomb qoymaq. *Dişi plomblamaq*.

**PLOMBLANMA** "Plomblanmaq"dan *f.is.*

**PLOMBLANMAQ** *məch.* 1. Plomb vurulmaq (qapıya və s.-yə).

2. Plomb qoyulmaq (dişə).

**PLOMBLU** *sif.* 1. Plomb vurulmuş, plombu olan; plomblanmış. *Plomblu qapı. Plomblu kassa*.

2. Plomb qoyulmuş, plombu olan, plomblanmış. *Plomblu diş*.

**PLOMBSUZ** *sif.* Plombu olmayan, plomb vurulmamış; plomblanmamış.

**PLOV** *is.* Bişirilib süzülmüş düyüdən və müxtəlif xuruşlardan ibarət çoxlu növləri olan məşhur Şərq xörəyi; aş. *Arabir plov, yazda da dolma hazırlanırdı.* T.Ş.Simurq. [Seyid:] *..Müsəlman aşpazı saxlayıram, gözəl plov, dovğa, dolma, küftə bişirir ki, ölü yesə dirilər.* Ə.Haqverdiyev.

**PLUTOKRÁT** [*yun.*] *kit.* Öz varı və dövləti sayəsində nüfuzu və hökmü olan adam.

**PLUTOKRATÍK** [*yun.*] *kit.* "Plutokratiya" söz. *sif. Plutokratik idarə üsulu*.

**PLUTOKRÁTİYA** [*yun.* plutos – var-dövlət və kratos – hakimiyyət] *kit.* 1. Dövlətin bir ovuc ən varlı adamlar tərəfindən idarə olunduğu siyasi quruluş.

2. *top.* Plutokratlar.

**PLUTÓNİUM** [*xüs. is.*-dən] Süni surətdə alınan radioaktiv xassəli kimyəvi element.

**PLUTONÍZM** *is.* [*yun.*] Təbii səbəblərin təsiri ilə Yer örtüyünün silsiləvi dəyişkənliyi barədə XVIII əsrin sonlarında geologiyada mövcud olan istiqamət.

**PLÜRALÍZM** *is.* [*lat.*] 1. Dünyanın əsasında müxtəlif müstəqil mənəvi mətləblərin durduğunu qəbul edən təlim.

2. Bir məsələ barəsində müxtəlif rəylərin olması; çoxfikirlilik.

**PLÜŞ** *is.* [*alm.*] Uzunxovlu məxmər örtüklü divan.

**PLYAJ** [*fr.*] Çimmək və ya günəş vannası qəbul etmək üçün istifadə edilən dəniz, göl və çayın qumlu və ya çınqıllı sahil zolağı; çimərlik. *Dəniz plyajı. Qumsal plyaj. – Bağda,*

*ya plyajda papaq – yan gəzən; təptəzə xuliqan görürəm, qorxmuram.* R.Rza.

**PLYONKA** [*rus.* плёнка] Foto və kino şəkilləri çəkmək, yaxud səs yazmaq üçün xüsusi materialdan hazırlanıb üzünə işığa həssas emulsiya çəkilmiş şəffaf elastik lent. *İmamzadə hirslə ayağa qalxdı, ipdən asılmış plyonkanı əlinə alıb baxdı.* Q.İlkin.

**PLYUS** *is.* [*lat.*] *riy.* 1. Üstəgəl.

2. Xeyir. *Bu işin plyusu çoxdur.*

**PNEVMÁTİK** *sif.* [*yun.*] Sıxılmış hava ilə hərəkətə gətirilən. *Pnevmatik silah. – Üç nəfər pnevmatik silah işləyirdi.* Ə.Sadıq. // Sıxılmış havanın gücü ilə görülən. *Pnevmatik qazıma*.

**PNEVMÁTİKA** [*yun.* pneumatika – hava] Pnevmatik qüvvə ilə hərəkətə gətirilən mexanizm, qurğu və alətlər.

**PNEVMONÍYA** [*yun.* pneumon] *tib.* Ağciyər iltihabı.

**POÇT(A)** [*pol.* poczta, əsli *ital.*] 1. Adresatlara pul, məktub və s. göndərməklə məşğul olan rabitə idarəsi və həmin idarənin yerləşdiyi bina. *Poçt işçiləri. Poçt binası. – Poçta yolum düşdü və bir açıq kağız alıb kəndimizə, Molla Cəfər rəfiqimizə müxtəsər yazdım...* C.Məmmədquluzadə.

2. Həmin idarə vasitəsilə alınan məktub, bağlama və s. *Poçtu nəzərdən keçirmək. – Qız, bu nədir, bu nə poçtadır belə? – deyə Zahidoğlu təəccüblə soruşdu.* S.Rəhimov.

**POÇTALYÓN** [*ital.* postiglione] Poçtla gələn məktubları, dövri mətbuatı və s.-ni adresatlara paylayan rabitə işçisi; məktubpaylayan. *Günortaüstü poçtalyon Bahadıra təcili bir məktub gətirdi.* S.Rəhman. *Poçtalyon Leylaya bir məktub verdi.* B.Bayramov.

**POÇTALYONLUQ** *is.* Poçtalyonun işi, vəzifəsi.

**POÇTÁMT** [*alm.*] Şəhərin baş poçtu, baş poçtxanası. *Bakı poçtamtı*.

**POÇTÇU** *is.* 1. Poçt işçisi, poçt xidmətçisi. *Səhər tezdən Yəhya Kamal məktubu poçtçu Aslana verdi*. Mir Cəlal.

2. *dan.* Poçtalyon.

**POÇTXANA** [*ital.* poczta və *fars.* ...xanə] Poçt idarəsinin yerləşdiyi bina; poçt.

**PODÁQRA** [*yun.* podagra] Orqanizmdə maddələr mübadiləsinin pozulması nəticəsində əmələ gələn və bədənin müxtəlif hissələrində duz yığılmasından ibarət olan oynaq və toxuma xəstəliyi.

**PODAQRALI** *sif.* Podaqra xəstəliyi olan (adam).

**PÓDİUM** *is.* [*lat.*] 1. Qədim Romada sirkdə hörmətli tamaşaçıların oturması üçün hündür yerlər.

2. Heykəltəraş və rəssamların işləməsi üçün uca yer.

3. Qədim romalıların sərdabələrində meyitin külü tökülmüş qabları qoymaq üçün yer.

**PODNÓS** [*rus.*] İçinə qab-qacaq qoymaq, süfrəyə xörək gətirmək və s. üçün işlədilən metal və sair materialdan düzəldilmiş məcməyi, sini. *Şəmsiyyə kiçik bir podnosda üç stəkan çay, şokolad və başqa şirniyyat gətirdi.* M.İbrahimov

**PODPOLKÓVNİK** [*rus.*] Mayor rütbəsindən sonra gələn zabit rütbəsi və habelə belə rütbəsi olan şəxs. *Mahmud içəri girəndə podpolkovnik bir xəritənin qarşısında durmuş, düşünürdü.* Ə.Əbülhəsən.

**PODPOLKOVNİKLİK** *is.* Podpolkovnik rütbəsində olma.

**PODRÁT** [*rus.* подряд] Müəyyən haqq müqabilində bir işi görməkdən ibarət öhdəlik və bu öhdəlik üzrə görülən iş. *Podrat iş.* ◻ **Podrata götürmək** – 1) müəyyən haqq müqabilində bir işi görmək üçün iltizam qəbul etmək. [Şeyda:] *İndi Aslan bəyin mədənini podrata götürmüşəm, ona iki buruq qazdırıram.* A.Şaiq; 2) *məc. dan. zar.* başqasına macal verməyərək bütün işləri ancaq özü görməyə çalışmaq. [Sədr:] *Ay Səlim! Bir macal ver, xalq da danışsın, danışmağı podrata götürməmisən ki?* Ə.Vəliyev.

**PODRATÇI** *is.* Podrat üzrə işləyən adam və ya təşkilat. *Podratçı Şeyda qarovulçunun üstünə bağırıb deyirdi*. A.Şaiq. *Kəndlilər daha ağır, daha dözülməz şərtlərlə adada neft anbarları qazan podratçıları işləməyə məcbur olurdular.* Ə.Məmmədxanlı. // Sif. mənasında. *Podratçı tikinti idarələri.*

**PODRATÇILIQ** *is.* Podratçının işi, podrat işi. *Podratçılıq və mədən işlərinə bələd olmayan Qulu başını itirmişdir.* A.Şaiq.

**PODVÁL** *is.* [*rus.*] Qəzet səhifəsinin ayrıca məqalə çap olunmuş aşağı hissəsi; habelə

qəzet səhifəsinin aşağı hissəsində dərc olunmuş məqalənin özü.

**POEMA** [*yun.*] 1. Mənzum hekayə janrı. *Nizaminin poemaları. S.Vurğunun "Bəsti" poeması. – "Qız qalası" poemasını Cəfər Cabbarlı 1923-cü və 1924-cü illərdə çap etdirmişdi.* M.Arif.

2. Sərbəst formalı, adətən lirik və ya instrumental mahiyyətli bəzi musiqi əsərlərinin adı. *Cahangir Cahangirovun "Arazın o tayında" simfonik poeması.*

**POETİK** *sif.* [*yun.*] 1. Poeziya ilə bağlı olan, poeziya ilə əlaqədar olan; bədii. *Poetik əsər.* // Poeziyaya xas olan; şairanə. *Poetik gözəllik. Poetik nitq. Yazıçı poetik dilə malik olmalıdır.*

2. Yaradıcılıq istedadı ilə, şairlik qabiliyyəti ilə bağlı olan; bədii. *Poetik istedad. Poetik təb.*

3. Estetik tələblərə cavab verən; gözəl, estetik, incə. [Q.Primovun] *çaldığı musiqidə ən kiçik melodik cümlə, ən xırda guşə, ən balaca ibarə belə özlüyündə çox zərif, çox incə bir poetik məna kəsb edir.* Ə.Bədəlbəyli.

**POETİKA** [*yun.*] 1. Ədəbiyyat nəzəriyyəsi, poetik yaradıcılıq haqqında elm.

2. Hər hansı bir şair və ya ədəbi məktəbə xas olan xüsusiyyət, tərz, üsul. *Füzulinin poetikası.*

**POETİKLİK** *is.* Şairanəlik, gözəllik, bədiilik, şeriyyət. *Poetik əfsanələr.*

**POEZİYA** [*yun.*] 1. Şeir. *Nəsr, dramaturgiya və publisistikada inqilabi satiranın yaradıcısı Cəlil Məmmədquluzadə olmuşsa, poeziyada Sabir olmuşdur.* M.İbrahimov. // Hər hansı bir xalqa, dövrə, ictimai qrupa və s.-yə məxsus şeir əsərlərinin məcmusu. *Antik poeziya. Romantik poeziya.*

2. *məc.* Şeriyyət, lirizm, incəlik, bədiilik.

**POQON** [*rus.*] Hərbi və ya başqa rəsmi paltarda çiyinə tikilən və ya yapışdırılan fərqlənmə nişanı. *Zabit poqonu.* – [Xortdan:] *Qolovinski çıxanda paqonları gün kimi parıldayırdı.* Ə.Haqverdiyev.

**POQONLU** *sif.* Poqonu olan. *Poqonlu soldat.*

**POLAD** *is.* [*fars.*] 1. Dəmir ərintisi ilə karbondan ibarət gümüşü-boz metal. *Polad ərintisi. Paslanmayan polad.*

2. Poladdan qayırılmış, poladdan hazırlanmış. *Polad rels. Polad dirək.*

3. *məc.* Çox güclü, qüvvətli şey haqqında. *Polad əzələ. – Birdir bu dünyada rəngi, qabarı; Tarixi yaradan polad əllərin!* S.Vurğun. // *məc.* Möhkəm, yenilməz, sarsılmaz. *Polad iradə.*

**POLADƏRİDƏN** *is. xüs.* Polad əritməklə məşğul olan usta; poladtökən.

**POLADƏRİTMƏ** *sif.* və *is.* Polad əritmək üçün olan, polad əridilən. *Poladəritmə sənayesi.*

**POLADI** *sif.* Polad rəngli, polad rənginə çalan, gümüşü-boz. *Poladı parça.*

**POLADLAMA** "Poladlamaq"dan *f.is.*

**POLADLAMAQ** *xüs.* Elektroliz vasitəsilə üzərinə nazik polad təbəqəsi çəkmək.

**POLADLAŞMA** "Poladlaşmaq"dan *f.is.*

**POLADLAŞMAQ** *f.* 1. Polad halına gəlmək.

2. *məc.* Bərkləşmək, möhkəmləşmək.

**POLADYAYAN** *sif. tex.* Poladı yayıb yastı hala salan. *Poladyayan dəzgah.* // *is.* Poladyayma ustası olan fəhlə. *Poladyayanların yarışı.*

**POLADYAYMA** *is. xüs.* Poladı yayıb yastı hala salma.

**POLÉMİKA** *is.* [*yun.*] Müəyyən bir məsələ barədə fikir mübadiləsi; mübahisə, müzakirə, dartışma.

**POLİARTRÍT** [*yun.* poly – çox və arthron – oynaq] *tib.* Oynaqların iltihabı.

**POLİETİLÉN** *is.* [*yun.*] Sintetik material.

**POLİFONİK** *sif.* [*yun.*] Polifoniyaya aid olan; çoxsəsli. *Polifonik musiqi.*

**POLİKLÍNİKA** [*yun.*] Müxtəlif ixtisaslar üzrə əhaliyə (istər gələn, istərsə də evdə yatan xəstələrə) həkim yardımı göstərən tibb müəssisəsi.

**POLİFONÍYA** [*yun.* polyphonia] *mus.* Vokal və ya instrumental əsərlərdə bir neçə səsin bir vaxtda birləşməsi; çoxsəslilik.

**POLİQLÓT** [*yun.*] Çox dil bilən adam.

**POLİQÓN** [*yun.*] Hərbi təlim, habelə müxtəlif silahların sınaqdan keçirilməsi üçün böyük sahə. *Poliqonda təlim keçmək.*

**POLİQRAFÇI** *is.* Poliqrafiya sənayesi işçisi, poliqrafiya mütəxəssisi.

**POLİQRAFİK** *sif.* [*yun.*] Poliqrafiya ilə əlaqədar olan, poliqrafiyaya aid olan. *Poliqrafik işlər. Kitabın poliqrafik keyfiyyəti.*

**POLİQRAFÍYA** [*yun.* polygraphia – çox yazı] Çap məhsulları istehsalının bütün növlərini əhatə edən texnika, sənaye sahəsi.

**POLİMÉRLƏR** *cəm* [*yun.* polymeres – çox hissədən ibarət] Kimyəvi tərkibi eyni olan, lakin molekuldakı atomların miqdarına görə isə bir-birindən fərqlənən maddələr. // Həmin maddələrdən hazırlanan, düzəldilən. *Polimer materiallar.*

**POLİNÉZİYA** *is.* [*yun.*] Sakit Okean adalar qrupu. *Polineziya adaları vulkan mənşəlidir.*

**POLİNEZİYALILAR** *cəm* Sakit okean adalarının (Polineziyanın) yerli əhalisi.

**POLİOMİELÍT** [*yun.* polios – boz və myelos – ilik] *tib.* Uşaq iflici.

**POLÍP** [*yun.* poly – çox və pus – ayaq] 1. *zool.* Yerindən hərəkət edə bilməyən dəniz heyvanı – bağırsaqboşluqluların oturaq növü. *Şirin su polipi. Mərcan polipi.*

2. *tib.* Burunun, analığın və s.-nin selikli qişasında əmələ gələn xoşxassəli şiş – göbələkvari patoloji törəmə.

**PÓLİS** [*alm.* polizai] 1. Polisiyada xidmət edən adam. *Araz cavab verməyib polislər ilə birlikdə qapıdan çıxdı.* A.Şaiq.

2. Polisiya, polis idarəsi. *Qorodovoy Kərbəlayı Zal iyirmi beş ildən artıq polis idarəsində xidmət edirdi.* Ə.Haqverdiyev. *Polis idarələri bir-birinə dəymiş, Cabbar bəyə əl qaldıran adam o günün axşamı həbs olunmuşdu.* M.Hüseyn.

3. Polis və jandarmeriyaya əsaslanan, güc və zorakılıq əsasında həyata keçirilən. *Polis terroru. Polis idarə üsulu.*

**POLİSEMÍYA** [*yun.* poly – çox və sema – işarə] *dilç.* Bir sözdə bir neçə mənanın olması; sözün çoxmənalılığı.

**POLİSİYA** [*alm.* polizei] 1. Mövcud quruluşun təhlükəsizliyini və onun qoymuş olduğu qanun-qaydaları qoruyan xüsusi inzibati orqan.

2. *top.* Bu orqanda xidmət edənlər; polislər.

**POLİSMÉN** [*ing.* policeman] İngiltərə və ABŞ-da polis nəfəri; polis.

**POLİSMEYSTER** [*alm.* polizeimeistr] 1917-ci il inqilabından qabaq Rusiyada: iri şəhərlərin polis rəisi.

**POLİTEXNİK** *sif.* [*yun.*] 1. Texnikanın müxtəlif sahələrinə aid olan, onlarla bağlı olan. *Politexnik institut. Politexnik muzey.*

2. Politexnizm əsasında qurulmuş. *Politexnik təhsil.*

**POLİTEXNİKİ** b a x **politexnik** 2-ci mənada.

**POLİTÉXNİKUM** [*yun.*] Politexnik məktəb.

**POLİTEXNÍZM** [*yun.*] Şagirdi istehsalatın bütün əsas sahələri ilə nəzəri və əməli tanış etmək əsasında qurulmuş təlim sistemi.

**POLİTOLOQ** *is.* [*yun.*] Siyasətlə və siyasət elmi ilə məşğul olan adam; siyasətşünas, siyasətçi.

**POLİTÚRA** *is.* [*lat.*] Ağacdan olan məmulatın üzərinə çəkib işıldatmaq üçün spirtli lak, spirtdə həll edilmiş qatran məhlulu.

**POLK** *is.* [*rus.*] Adətən diviziya, ya briqada tərkibinə daxil olan müstəqil qoşun vahidi. *Qvardiya polku. Polk komandiri. Tank polku. – Firidunu polk qərargahının qarşısında saxlamışdılar.* Mir Cəlal.

**PÓLKA** *is.* [*çex.* polka] 1. Cəld oynanılan Avropa rəqslərindən birinin adı, habelə həmin rəqsin musiqisi. *Nəfəsli musiqi çalsa polkanı; Qızışır köhnənin soyumuş qanı.* H.K.Sanılı.

2. Həmin rəqs ritmində musiqi əsəri. *Raxmaninovun polkası.*

**POLKÓVNİK** *is.* [*rus.*] Podpolkovnik rütbəsindən sonra gələn zabit rütbəsi və ya adı, habelə belə rütbəsi və ya adı olan şəxs. *Uzun, gözü eynəkli, polkovnik rütbəsində ikinci bir zabit də buraya yanaşdı.* S.Vəliyev.

**POLKOVNİKLİK** *is.* Polkovnik rütbəsində olma.

**POLONÉZ** *is.* [*fr.*] Milli polyak rəqsi.

**POLOVÉS** *is.* Türk tayfalarından biri və həmin tayfaya mənsub olan adam; qıpçaqlar.

**POLYAK** Qərbi slavyan xalqlarından biri və bu xalqa mənsub adam.

**POLYAKCA** *sif.* və *zərf* Polyak dilində. *Polyakca kitab. Polyakca-rusca lüğət.*

**POLYARLAŞMA** *fiz.* İşıq və elektromaqnit titrəyişlərinin müəyyən bir səth üzərində baş verməsi xassəsi.

**POMADA** [*fr.*] Müxtəlif ətirli maddələrin qatışığından ibarət kosmetik yağ. *Dodaq po-*

*madası. – Çantasında cürbəcür pomada, üz-yağı var; Dillənir dindirməmiş gərəksiz bir saz kimi.* S.Rüstəm.

**POMADALI** *sif.* Pomada çəkmiş (çəkilmiş), pomada sürtmüş (sürtülmüş). *Pomadalı qız.*

**POMİDÓR** [*ital.* pomidoro] Quşüzümü ailəsinə mənsub bostan bitkisi. *Pomidor şitil etmək.* // Həmin bitkinin girdə qırmızı meyvəsi. *Bazardan pomidor almaq. –* [Məcid kişinin] *qabağındakı ağ süfrənin üstündə göy-göyərti, pendir, çörək, pomidor, bir kasa da qatıq vardı.* İ.Məlikzadə.

**PONÇİK** [*pol.* paczek] İçinə mürəbbə, riçal və ya başqa şirni qoyulan kömbə, qoğal.

**PÓNÇO** *is.* [*isp.*] Düzbucaq biçimli plaş.

**PÓNİ** [*ing.*] Kiçikboylu at cinsi.

**PONTÓN** [*fr.*] 1. Müvəqqəti körpü və ya bir şeyi su üzərində saxlamaq üçün, yaxud da bərə kimi istifadə olunan yastıdibli gəmi, qayıq. // Belə gəmilərin üstündə qurulan müvəqqəti körpü. *Ponton qurmaq. Ponton körpü.*

2. Batmış gəmiləri çıxararkən istifadə olunan boş çəllək və s. şəklində olan polad qurğu.

**PONTONÇU** *is.* Mühəndis qoşunları hissələrində xidmət edən hərbi qulluqçu; ponton quraşdırma mütəxəssisi.

**POPLÍN** *is.* [*fr.*] Qabarıq zolaqlı ipək və pambıq qarışığından parça.

**POPULİST** *is.* və *sif.* [*lat.*] Populyarlıq və kütlənin rəğbətini qazanmaq üçün icrası qeyri-mümkün böyük vədlər verən siyasətçi və hərəkat.

**POPULYAR** *sif.* [*lat.* popularis – xalq] 1. Anlaşılan sadə dildə yazılmış; məzmunu, ifadə tərzi sadə olan; kütləvi. *Populyar kitab. Populyar dildə yazılmış əsər.*

2. Məşhur, geniş kütlələrin rəğbətini qazanmış. *Populyar musiqi. Populyar müğənni.* // Geniş yayılmış, kütləvi. *Populyar məcmuə.*

**POPULYARLIQ** *is.* Məşhurluq; geniş kütlə tərəfindən tanınma, sevilmə, onun rəğbətini qazanma.

**POPURRÍ** *is.* [*fr.*] 1. Populyar opera, operetta, balet, xalq mahnıları və rəqs motivlərindən tərtib edilən musiqi əsəri.

2. Qarmaqarışıq.

**POROŞOK** [*rus.*] Bərk maddənin toz halına salınmış hissəcikləri; toz.

**PORS** "Порция" sözünün canlı dildə işlənilən yanlış forması. [Tələbə:] *Üçümüzə iki pors şişlik* [sifariş] *etdik.* Qantəmir.

**PORSİYA** [*lat.*] Yeməkxanada, restoranda bir adamlıq xörək və ya içki. [Mirzə Mahmud:] *Mənim üçün, deginən, yarım porsiya kotlet versinlər.* Ə.Haqverdiyev.

**PORSUQ** *is. zool.* Dələ fəsiləsindən çənəsi iti, bədəni yöndəmsiz, uzun qaba yunluq, xəzli yırtıcı heyvan. *Bostana girən porsuq yabanı qəbul eylər.* (Ata. sözü). [Zeynal:] *Aşağıgüllüyə gedirik, deyirlər, oralarda porsuq var.* Ə.Əbülhəsən.

**PORSUMAQ** *f.* 1. Turşumaq, kiflənmək.

2. *məc.* Özündən çıxmaq, qabarmaq.

**PÓRŞEN** *is.* [*rus.*] Mayeləri, buxarı, qazları qovan silindrik hissə.

**PORTAĞAL** *is. bot.* Cənubda bitən həmişəyaşıl sitrus ağacı. [Səfərli:] *Saysız-hesabsız meyvə, portağal ağacları çiçəkləyəcək.* H.Seyidbəyli. // Həmin ağacın qalın narıncı qabıqlı, sulu, dilimli yumşaq meyvəsi.

**PORTÁL** [*lat.* porta – giriş, darvaza] Böyük binanın memarlıq cəhətdən işlənmiş və ya ümumi fonda ayrılmış baş girəcəyi. *Sütunlu portallar.*

**PORTATİV** *sif.* [*fr.*] Yanda, əldə gəzdirilə bilən; yüngül, yığcam. *Portativ maqnitofon. Portativ radio.*

**PORTFEL** [*fr.*] Kitab, dəftər, kağız qoymaq üçün əldə gəzdirilə bilən dəstəli çanta. *Dəri portfel. Qara portfel. – Qoltuqlarında kağız qovluğu və ya portfel olan çinovniklər, vəkillər girib-çıxırdılar.* T.Ş.Simurq. *Yarməmməd portfelindən bir dəstə əzik-üzük kağız çıxardı.* M.İbrahimov.

◊ **Nazir portfeli** – nazir vəzifəsi. **Redaksiya portfeli** – bir redaksiyanın, nəşriyyatın çap olunmaq üçün qəbul etmiş olduğu əlyazmalarının hamısı bir yerdə.

**PORTFELLİ** *sif.* Əlində portfeli olan, əlində portfel tutmuş. *Portfelli kişi. – Bu saat qulluqdan çıxıb portfelli* (z.) *gələcək.* H.Nəzərli.

**PORTFELSİZ** *sif.*: **portfelsiz nazir** – bəzi ölkələrdə: dövlət idarələrinin ayrıca bir sahəsinə rəhbərlik etməyən, lakin xüsusi tapşırıqları yerinə yetirən nazir.

**PORTMANAT** [*fr.* porte-monnaire "portmane" sözündən] Pulqabı, pul kisəsi.

**PORTRÉT** [*fr.*] Bir şəxsin və ya bir dəstə adamın rəssam tərəfindən çəkilmiş şəkli, yaxud heykəltəraş tərəfindən verilmiş təsviri. *Xalının üstündə .. zərli çərçivəyə salınmış iri portret vardı.* M.Hüseyn. *Divara bir neçə məşhur artistin portreti vurulmuşdu.* İ.Əfəndiyev. // Foto ilə çəkilmiş adam şəkli. // *məc. dan.* Başqasına çox oxşayan adam haqqında. *Uşaq lap atasının portretidir.* // Ədəbi əsərdə personajın xarici görkəminin təsviri; surət. *C.Məmmədquluzadə portret ustasıdır.*

**PORTRETÇİ** *is.* Portret çəkməkdə mahir olan rəssam.

**PORTSİQAR** [*fr.*] Papiros və ya siqaret qoymaq üçün kiçik yastı qutu, qab; papirosqabı. *Əşrəf Sultanov stolun üstündə açıq qoyulmuş gümüş portsiqarından bir papiros götürüb yandırdı.* İ.Əfəndiyev.

**PORTUQALCA** *sif.* və *zərf* Portuqal dili. *Portuqalca danışmaq.*

**PORTUQALİYALI** *is.* Portuqaliyanın əsas əhalisini təşkil edən xalqa mənsub adam.

**PORTVÉYN** [*alm.*] Tünd üzüm şərab növü.

**PORTYE** *is.* [*fr.*] Mehmanxana xidmətçisi, qapıçı.

**PORUQ** b a x **qurbağaotu**.

**POST** [*fr.*] 1. Bir şeyi və ya şəxsi müşahidə altında saxlamaq və ya mühafizə etmək üçün yer, məntəqə. *Belə qorxulu vaxtda postdan uzaqlaşmaq olarmı?* H.Nəzərli. [Keşikçilər] *durmadan öz postları ətrafında dolaşırdılar.* S.Vəliyev.

2. Bir şeyi mühafizə etmək və ya müşahidə altında saxlamaq üçün müəyyən yerdə qoyulmuş növbətçi və ya əsgər dəstəsi. *Mədədov taqımı gəzib, postları yoxlayıb, keşikdən azad olan əsgərin istirahət etdiyinə, yuxuladığına baxırdı.* Ə.Əbülhəsən.

3. *xüs.* İstehsal prosesinin telemexanika, siqnal və s. vasitəsilə idarə olunduğu yer. *Rəis operator postlarından birinə çıxır, kimə isə göstəriş verir.* (Qəzetlərdən).

4. *dan.* Məsul vəzifə. *Direktorluq postu. Məsul post.*

**POSTAMÉNT** [*alm.* postamente] 1. Abidə, sütun, heykəl və s.-nin özülü, altlığı. *Qranit postament. Nizaminin heykəlinin postamenti.*

2. Muzey, sərgi və s.-də heykəlin qoyulduğu altlıq. *Postamentin üstündəki təyyarə abidəsi gün işığında elə parıldayırdı, elə işıldayırdı, deyirdin bəs təyyarə deyil bu, qanadlı bir günəşdi doğub burda.* İ.Məlikzadə.

**POSTSOVET** *sif.* [*rus.*] SSRİ-nin süqutundan, sovet quruluşu dağıldıqdan sonrakı dövr. *Postsovet məkanındakı müstəqil türk respublikaları.*

**POSTULÁT** [*lat.*] *fəls.* Müəyyən elmi nəzəriyyənin başlanğıc nöqtəsi kimi qəbul edilən və bir qayda olaraq, həmin nəzəriyyə çərçivəsində isbat olunmayan prinsip və ya hökm. *Məntiqdə və elmin metodologiyasında "postulat" anlayışından "aksiom" anlayışının sinonimi kimi də istifadə olunur.*

**POŞA** *is. köhn.* Əxlaqsız, pozğun, tərbiyəsiz adam. [Şərəfnisə:] *Parijdə sənin kimi oğlan bu poşaların əlindən sağ qurtara bilərmi ki, qayıdıb gələndən sonra adam kimi durub-otura.* M.F.Axundzadə.

**POTA** 1. *is.* Adətən donuz, ayı balasına deyilir. *Donuz potası. – Mağara o qədər kiçik idi ki, içindəki iki ayı balası* (*potası*) *apaçıq görünürdü.* A.Şaiq.

2. B a x **potaboy(lu)**. *Pota oğlan. Pota kişi.*

**POTABOY(LU)** *dan.* Boyu alçaq, lakin kök, koppuş, dolğun. *..Potaboy adamın fəaliyyətsizliyi, kütlüyü Səmədi dəhşətə gətirirdi.* İ.Hüseynov.

**POTÁŞ** [*holl.* potasch] Ağac və ya ot gülündən alınan kalium xlorid.

**POTENSİÁL** [*lat.* potentia – qüvvə] 1. *fiz.* Müəyyən nöqtədə bir şeyin enerjisini, gərginliyini və s. səciyyələndirən vahidə bərabər kəmiyyət. *Cazibə qüvvəsinin potensialı.*

2. *məc. kit.* Müəyyən məqsəd, iş üçün lazım olan şərtlərin, vasitələrin məcmusu. *Dövlətin sənaye potensialı.*

3. *sif.* Üzə çıxa bilən, mümkün ola bilən, tez-gec özünü göstərə bilən; gizli şəkildə qalan. *Triyestdə potensial bir qüvvə hökm sürürdü.* S.Vəliyev.

**POTENSİYA** *is.* [*lat.*] İmkan, qabiliyyət, bacarıq, iqtidar.

**POVEST** [*rus.* повест] Süjeti romana nisbətən daha sadə və həcmcə ondan daha kiçik olan bədii əsər. *S.Rəhimovun "Aynalı" povesti. Povest yazmaq.*

**POVESTÇİ** *is.* Povest yazan yazıçı, ədib.

**POVÍDLO** [*rus.*] Şəkər və ya patkada bişirilmiş əzilmiş meyvə maddəsi; riçal.

**POZA** *is.* [*fr.*] 1. Duruş, vəziyyət.

2. *məc.* Səmimi olmayan davranış, riyakarlıq.

**POZAN** *is.* Yazı, şəkil və s. pozmaq üçün rezin parçası.

**POZDURMA** "Pozdurmaq"dan *f.is.*

**POZDURMAQ** "Pozmaq"dan *icb.*

**POZĞUN** *sif.* 1. Əxlaqsız, əxlaqı pis. [Qaçay:] *Sizin məktəbin tələbəsi Mahmud Mərdanoğlu dünən axşam bir dəstə pozğun adamlarla qumar oynayırmış.* Z.Xəlil.

2. Pozulmuş halda olan, pozulmuş, dağılmış, bərbad hala gəlmiş, nizamsız. *İraq və Bağdad qoşunu bütün .. qərargahını və ərzaq şeylərini, silah və yük mallarını buraxıb nizamsız və pozğun bir surətdə qaçmışdı.* M.S.Ordubadi.

3. Pərişan, pis. *Əhvalım elə pozğun idi ki, yuxu-zad məndən çox uzaq idi.* C.Məmmədquluzadə.

**POZĞUNLAŞDIRMA** "Pozğunlaşdırmaq"-dan *f.is.*

**POZĞUNLAŞDIRMAQ** *f.* 1. Pozğun hala gətirmək, bərbad hala salmaq, pozub dağıtmaq.

2. Əxlaqca pozmaq. *Pis mühit uşağı pozğunlaşdıra bilər.*

**POZĞUNLAŞMA** "Pozğunlaşmaq"dan *f.is.*

**POZĞUNLAŞMAQ** *f.* 1. Pozğun olmaq, əxlaqı pisləşmək, xarablaşmaq.

2. Pozulmaq, pərişan olmaq, xarablaşmaq. [Dərviş:] *Huşum və bədənim ləmsləşdi, pozğunlaşdı, özümü duymaz oldum..* A.Divanbəyoğlu.

3. Pozğun hala gəlmək, intizamdan çıxmaq, qayda-qanuna riayət etməməyə başlamaq. *Pozğunlaşmış silahlı dəstəni tərk-silah etmək.*

**POZĞUNLUQ** *is.* 1. Əxlaqsızlıq, mənən pozulmuş adamın hal və keyfiyyəti. [Zeynal] *get-gedə məişət pozğunluğunun çirkabı içinə yuvarlanırdı.* S.Hüseyn.

2. Nizamsızlıq, qarışıqlıq, pərakəndəlik, ixtilaf, pərtlik, dilxorluq. *Məclisə pozğunluq düşmək. – ..Süfrə başında pozğunluq yaratmaq istəmədim.* M.S.Ordubadi. // Məğlubiyyət, yenilmə. *Pozğunluğa uğramaq.*

3. Pərişanlıq, xarablıq. *Əhvalın pozğunluğu. – Arvad ərinin halətinin pozğunluğunu xəbər aldıqda Mirzə dedi: – Nə eləyim, ay arvad. Bu gün-sabah uşaqları məktəbdən xaric edəcəklər.* Ə.Haqverdiyev.

**POZÍSİYA** *is.* [*lat.*] 1. Mövqe.

2. Duruş, vəziyyət.

3. Döyüş meydanı.

4. Baxım, rəy, münasibət.

**POZİTİVÍST** [*yun.*] Pozitivizm tərəfdarı.

**POZİTİVÍZM** [*lat.* positivus – müsbət] Obyektiv varlığın və şeylərin mahiyyətinin dərk oluna bilməsini inkar edən, təcrübəni təhrif edərək onu subyektiv hiss və təsəvvürlərin toplusu kimi izah edən, elmin rolunu, faktları təsvir etmək və sistemləşdirməklə məhdudlaşdıran, onların izahının mümkünlüyünü qəbul etməyən idealist fəlsəfi cərəyan.

**POZMA** "Pozmaq"dan *f.is.*

**POZMAQ** *f.* 1. Yazını rezin və s. ilə silmək, yaxud üstündən xətt çəkməklə qaralamaq. *Əlyazmasının bir abzasını pozmaq.* – [Balarza:] *Məni qana salma, poz, sənə deyirəm.* C.Cabbarlı. *Cəmilə yazdığını oxudu, bəyənmədi, pozdu, yenidən düzəltdi.* S.Rəhimov.

2. *məc.* İcazə verilməyən bir iş görmək, qaydadan kənara çıxmaq. *Nizam-intizamı pozmaq. Qaydanı pozduğu üçün cərimələnmək.* // İcazə verilməyən, qadağan olunmuş yerdən keçmək. *Sərhədi pozmaq.* – [İnci:] *Düşmənlər hüdudu pozmuşdur deyə; Gedirəm xanıma xəbər verməyə.* A.Şaiq.

3. *məc.* Adi qayda ilə inkişaf etməsinə mane olmaq, qarmaqarışıqlıq törətmək, nizamsız hala salmaq, dağıtmaq. [Gənc:] *Birinin işləyən, o birinin müftə yeyən olması insanların həyatını pozmuşdur.* Çəmənzəminli. *Amansız müharibə ..* [kəndlilərin] *yaşayışını pozmuş, yurdlarını dağıtmış, özlərini də dilənçi halına salmışdı.* T.Ş.Simurq. // *məc.* Mane olmaq, maneçilik törətmək, əngəl törətmək. *İşin gedişini pozmaq. – Xanlar bu hərəkətilə bayram təntənəsini pozmaq istəyirdi.* Mir Cəlal. [Gülxar Nərgizə:] *..Gərək özgəsinin dincliyini pozmayasan.* B.Bayramov.

4. *məc.* Nizamsız hala salmaq, qarışdırmaq, səliqədən salmaq. *Əl uzadıb baş bəzəyin pozasan; Hər birin bir yana atasan dürüst.* M.P.Vaqif.

5. *məc.* Dəyişmək, dəyişdirmək (əsasən inkarda işlədilir). *Rüstəm kişi isə vəziyyətini pozmadan, soyuqqanlılıqla dedi.* M.İbrahimov. *Pristav camaatın arasında təmkin və vüqarını pozmamağa çalışdısa da bacarmadı.* Ə.Vəliyev.

6. *məc.* Danışmağa başlamaq, sükuta, sakitliyə son qoymaq. *Sakitliyi pozmaq. – Aralığa çökən sükutu artıq heç kəs pozmadı.* Ə.Məmmədxanlı. *Araya çökən sükutu pozmaq .. məqsədilə dilləndim.* M.Rzaquluzadə.

7. B a x **qarışdırmaq** 3-cü mənada. *Kefini pozmaq.*

8. "Əhdi", "ilqarı", "peymanı", "vədini" sözləri ilə – verdiyi sözdən qaçmaq, əhdinə vəfa etməmək. [Nüşabə:] *Olsa yer, göy mənə qarşı əlbir; Pozmaram əhdi, sözüm birdir, bir!* A.Şaiq. *Unudur verdiyi əhdi, ilqarı; Pozur peymanını tez insan oğlu.* Aşıq Şəmşir.

**POZUCU** *is.* 1. Hər hansı bir qaydanı, qanunu, üsulu və s.-ni pozan.

2. Pozğunluq salan, nizamsızlıq, qaydasızlıq törədən. *Pozucu ünsürlər.*

3. Dağıdıcı, yıxıcı, viranedici, xaraba qoyan. *Pozucu basqınlar.*

**POZUCULUQ** *is.* Pozucunun gördüyü iş, pozğunluq salma işi.

**POZUQ** *sif.* 1. Pozulmuş, silinmiş, qaralanmış. *Sətirdə pozuq yeri oxumaq olmur.*

2. Bərbad, düzgün olmayan, təhrif edilmiş, düzgün tələffüz edilməyən. *Pozuq dildə danışmaq.* – [Zabit:] *Sizin diliniz pozuq əcəm dilidir.* H.Nəzərli.

**POZUQLUQ** b a x **pozğunluq** 3-cü mənada.

**POZULMA** "Pozulmaq"dan *f.is. Övladı başlı-başına buraxmaq – ictimai asayişin pozulmasına səbəb olmaq, cəmiyyətə zərər vermək deməkdir.* S.Rəhimov.

**POZULMAQ** *məch.* 1. Üstündən xətt çəkilmək; silinmək, qaralanmaq (yazı haqqında). *Yazılan pozulmaz.* (Məsəl). *Vaxtında dərsə gəlməyənlərin adı pozulacağı ehtimalı var idi.* T.Ş.Simurq. *Oğurluq haqqında çox yazıldı, pozuldu, heç bir şey çıxmadı.* Mir Cəlal.

2. *məc.* Əhvalı pisləşmək, məyus olmaq; kefsizləşmək. *Əhvalı pozulmaq. – Araz onun bu sözündən olduqca pozuldu.* A.Şaiq. *Kamal yuxudan ayılıb, atasının getdiyini biləndə çox pozuldu.* M.Rzaquluzadə.

3. *məc.* Vəziyyəti pisləşmək, xəstəliyi ağırlaşmaq, halı xarablaşmaq. [Ağaverdinin] *maaşı xərcinə çatmadığı bir zamanda səhhəti də pozulmuşdu.* S.Hüseyn. [Hüseyn:] *Hacı bu gün lap pozulubdur.* Qantəmir.

4. *məc.* Bir-birinə qarışmaq, səliqəsiz halda olmaq, səliqədən düşmək. *Gənc mühəndis saçlarının səliqəsi pozulmadığına tamamilə əmin olduğu halda, yenə əlini başından ayırmadı.* M.Hüseyn.

5. *məc.* Adi qayda ilə inkişaf etməsinə maneçilik törədilmək, nizamsız hala salınmaq. *Lakin bu gün Rüstəm kişinin evindəki ahəng pozulmuş, yerini soyuq bir sükuta vermişdi.* M.İbrahimov. *..Kişisi cavan yaşında öldüyündən Durnanın həyatı pozulmuşdu.* Ə.Sadıq.

6. B a x **qarışmaq** 6-cı mənada. *Günorta hava pozuldu.*

7. *məc.* İcazə verilməyən bir iş görülmək, qaydadan kənara çıxılmaq. *Küçə hərəkəti qaydaları pozulmuşdur. İntizam pozulmuşdur.*

8. *məc.* Maneçilik törədilmək, həyata keçirilməsinə yol verilməmək. *İclas pozuldu.* – [Yunis:] *Bu nişan pozulmalıdır.* Ə.Məmmədxanlı.

**POZULMAZ** *sif.* Pozulmayan, başqa şəklə düşməyən, dəyişməz, sabit şəkildə qalan. *Müəllimin bu sözləri özünün bütün mülayim ahəngi ilə, bütün mənalı ifadəsi ilə birlikdə bir vəsiyyət kimi, pozulmaz bir and kimi Firidunun xəyalına yapışardı.* M.İbrahimov.

**POZULMUŞ** *f.sif.* 1. Üstündən xətt çəkilmiş; qaralanmış, silinmiş. *Pozulmuş cümlə. – Yazısı pozulmuş kağız hisdən sapsarı saralmışdı.* B.Bayramov.

2. *məc.* Adi qaydadan çıxmış, nizamsız hala salınmış; nizamsız, pərakəndə. *Pozulmuş quş dəstəsi yenidən cərgələnib uzaqlaşdı.* H.Seyidbəyli.

3. *məc.* Bikef olmuş, əhvalı qarışmış; məyus, pərt. *Məsumə məktubu oxuyandan sonra əhvalı pozulmuş bir halda divanda uzanıb fikrə getdi.* S.Şamilov.

4. B a x **pozğun** 1-ci mənada. *Yazıq! Zəhərlədi o gözəl qızı; Həyatın pozulmuş bir əxlaqsızı.* S.Vurğun.

**POZULUŞMA** "Pozuluşmaq"dan *f.is.*

**POZULUŞMAQ** *qarş.* Araları dəymək, küsüşmək. [İnci:] *Biz Mürşidlə bu binanın üstə pozuluşduq*. S.Rəhman.

**PÖHRƏ** *is.* 1. Ağac və kolların dibindən göyərən zoğ(lar), bic(lər). *Ağacın pöhrələrini qırmaq. – İllərdən bəri suyun lilləndiyi bu adalarda balaca pöhrələr əmələ gəlmiş, get-gedə qalınlaşıb meşəyə dönmüşdü.* İ.Şıxlı.

2. Cavan budaq, qol. // Cavan ağac, fidan. *Bağban təzə basdırdığı; Bir pöhrəyə dayaq vurur..* N.Rəfibəyli.

**PÖHRƏLƏNMƏ** "Pöhrələnmək"dən *f.is.*

**PÖHRƏLƏNMƏK** *f.* 1. Ağac və kolların dibindən pöhrə göyərmək. *Nar ağacı tez pöhrələnir. – Yer buğlandıqca ağaclar pöhrələnir, güllər qönçələnir, taxıllar qalxırdı.* İ.Şıxlı.

2. Cavan budaqlar, qollar, zoğlar əmələ gəlmək. *Ağaclar yenidən pöhrələnir*. M.İbrahimov.

**PÖHRƏLİ** *sif.* 1. Pöhrəsi olan; zoğlu. *Pöhrəli ağac*.

2. Çoxlu cavan ağaclar bitmiş. *Qalın pöhrəli dağın ətəyini Qaradağ xanlığının geniş və qocaman bağı tutmuşdu*. S.Rəhimov.

**PÖHRƏLİK** *is.* Çoxlu cavan ağaclar bitmiş yer, çoxlu cavan ağac olan sahə. *Pöhrəliyi tarla üçün təmizləmək. – Qaçaq Nəbi ağ çadırı söküb, ağac-uğacına qədər pöhrəlikdə gizlətmişdi.* S.Rəhimov. *Rayon mərkəzindən çıxıb sola burulanda pöhrəliyin ortası ilə dolayı yol uzanırdı.* Ə.Vəliyev.

**PÖRŞƏLƏMƏ** "Pörşələmək"dən *f.is.*

**PÖRŞƏLƏMƏK** *f.* Pörtüb tükünü çıxarmaq, təmizləmək. [Odabaşı:] *İbrahim qırx-əlli cücə başı kəsib bədənlərini pörşələyirdi.* Ə.Haqverdiyev. *Növrəstə qazan asıb toyuğu pörşələməyə başladı.* S.Rəhimov.

**PÖRTLƏMƏ¹** "Pörtləmək¹"dən *f.is.*

**PÖRTLƏMƏ²** "Pörtləmək²"dən *f.is.*

**PÖRTLƏMƏK¹** bax **pırtlamaq** 1 və 2-ci mənalarda.

**PÖRTLƏMƏK²** bax **pörtmək**.

**PÖRTLƏTMƏ** "Pörtlətmək"dən *f.is.*

**PÖRTLƏTMƏK** "Pörtləmək²"dən *icb.* *Göyərti yumşalana qədər ağzı örtülü qabda pörtlədin*.

**PÖRTMƏ** "Pörtmək"dən *f.is.*

**PÖRTMƏK** *f.* 1. Qırmızı olmaq, qırmızılaşmaq, qırmızı rəng almaq, qızarmaq. *Kiçikbəyimin buğdayı üzü pörtür, nəşə ilə əllərini ovuşdurur..* Çəmənzəminli. *Gülşən pörtdü. İşin içindən çıxmaq üçün yol axtardı*. Ə.Vəliyev.

2. Üzdən yanmaq, yanıb qızarmaq, qarsaqlanmaq. *Alov üzümü pörtdü. – Uzun illərdən bəri oda yaxın olduğundan bu arvadın üzü .. pörtmüşdü*. Ə.Əbülhəsən.

3. Qaynar suya salıb çıxarmaq, üstünə qaynar su tökmək; pörtləmək. *Aşpaz xoruzu pörtmək üçün qaynar su ilə dolu bir qazana salır.* (Nağıl). [Çərkəz:] *Pencər yaxşıdır. Heç bu il nubar eləməmişəm. İstəyirsən balığı da pörtdət.* İ.Şıxlı.

**PÖRTÜLMƏ** "Pörtülmək"dən *f.is.*

**PÖRTÜLMƏK** *f.* 1. Pərt olmaq, qızarmaq. [Sirat:] *Gözlərin qızarıb, pörtülmüsən*. Ə.Əbülhəsən.

2. *məch.* Qaynar suya salınıb çıxarılmaq, yaxud üstünə qaynar su tökülmək. *Pörtülmüş* (f.sif.) *badımcanları aşsüzənə yığıb suyunun tamam süzülməsi üçün üzərinə bir ağır qab qoymaq lazımdır.*

**PÖRTÜŞMƏ** "Pörtüşmək"dən *f.is.*

**PÖRTÜŞMƏK** bax **pörtmək** 1-ci mənada. *Söylə, neçin pörtüşdün, söylə, qızardın neçin?* S.Rüstəm.

**PRAKTİK** *sif.* [*yun.*] 1. Praktikaya aid olan, praktika ilə, real tələbat və imkanlarla əlaqədar olan; təcrübi. *Praktik məqsəd.*

2. Bilavasitə bir işlə məşğul olan, bir işə, ya şəxsə rəhbərlik edən. *Praktik rəhbərlik.*

3. Hər hansı elmi sahənin, bilik, nəzəriyyə və s.-nin praktikaya tətbiqi ilə bağlı olan, ona əsaslanan. *Praktik məşğələ.* – [Tərlan:] *Sən* [Xəlil] *praktik işdə çalışa-çalışa öz səviyyəni artırmalısan*. M.Hüseyn.

**PRÁKTİK** [*yun.*] Öz işini təcrübi cəhətdən yaxşı bilən, öz ixtisası üzrə böyük təcrübəsi olan; ancaq praktika yolu ilə böyük təcrübə qazanmış adam. // İşgüzar adam.

**PRÁKTİKA** [*yun.* praktikos – işcil] bax **təcrübə**. *Praktika göstərdi ki, opera bütünlükdə geniş tamaşaçı kütlələrinə çata bilmişdir və bunun səbəbi də operanı yazarkən onun musiqi tekstində və həmçinin yaradıcılıq fantaziyamda muğam sistemini əsas götürməyim olmuşdur.* Ü.Hacıbəyov.

**PRAKTİKÁNT** [*yun.*] Təcrübə keçən adam; təcrübəçi. *Praktikant tələbə.*

**PRAKTİKİ** b a x **praktik**. *Atasının təklifi* [Əzizin] *ağlına batsa da, bu işin praktiki həllində acizlik çəkirdi.* Ə.Vəliyev.

**PRAKTİKLİK** *is.* Həyata praktik münasibət, hər şeydən fayda götürmə bacarığı; praktisizm (2-ci mənada).

**PRÁKTİKUM** [*yun.*] Hər hansı bir fənn üzrə praktik məşğələ növü (əsasən ali məktəblərdə). *Kimyadan praktikum. Praktikum rəhbəri.*

**PRAKTİSÍZM** [*yun.*] 1. Nəzəri biliyin əhəmiyyətini qiymətləndirməyərək, praktik fəaliyyətə üstünlük vermə.

2. Bir şeyə işgüzar münasibət. // İşləri öz xeyrinə qura bilmə bacarığı.

**PRAQMÁTİKA** *is.* [*yun.*] İşarə sistemi ilə onu tətbiq edənin arasındakı əlaqəni öyrənən bilik sahəsi.

**PRAQMATİST** [*yun.*] 1. Praqmatizm tərəfdarı.

2. Tarixi faktların şərhində praqmatizm tərəfdarı olan tarixçi.

**PRAQMATÍZM** [*yun.* pragma – iş, praktika] 1. Müasir fəlsəfədə geniş yayılmış subyektiv idealist cərəyan (uzun müddət ABŞ-ın mənəvi həyatında hökmran olmuş, yalnız müharibədən sonra öz mövqelərini neopozitivizmə və dini konsepsiyalara vermişdir). *Praqmatizm fəlsəfəsinin mərkəzində biliyin məzmununu onun praktik, əməli nəticələri ilə müəyyən edən* "*praqmatizm prinsipi*" *durur.*

2. Tarix elmində: inkişafın obyektiv qanunlarını açıb göstərmədən tarixi hadisələrin xarici əlaqə və ardıcıllığını izah etməklə kifayətlənən cərəyan.

**PRÁPORŞİK** [*rus.*] Ordu və donanmada ən kiçik zabit rütbəsi; habelə belə rütbəsi olan hərbi xidmətçi.

**PRAVOSLAV** [*rus.* православие] 1. Xristianlığın mühüm bir qolu olub Bizansda təşəkkül tapan dini məzhəb. *Pravoslav məzhəbinin nümayəndələri.*

2. Bu məzhəbə etiqad edən (adam). *Pravoslav xalqlar. Pravoslav missionerlər.*

**PRAVOSLAVLIQ** *is.* Xristianlığın başlıca olaraq Şərqi Avropa, Yaxın Şərq və Balkanlarda yayılmış mühüm cərəyanlarından biri. *Pravoslavlığın ehkam mərkəzləri. Pravoslavlığın dini fəlsəfəsi.*

**PREÁMBULA** *is.* [*fr.*] Hər hansı bir qanunun, qərarın giriş hissəsi.

**PREDİKÁT** [*lat.*] 1. Məntiqdə: hökmün obyekti haqqında deyilən fikir; məntiqi xəbər. *Predikatın və subyektin ənənəvi anlayışları. Predikatın yeni şərhi.*

2. *qram.* Xəbər.

**PREDİKATİV** *sif.* [*lat.*] *mənt. qram.* Predikat funksiyasında işlənən, predikat olan. *Predikativ zərf.*

**PREDİKATİVLİK** *is. mənt. qram.* Predikatın xassəsi. *Predikativlik xüsusiyyəti. Predikativliyin ifadə vasitələri.*

**PREDNİZOLÓN** *is.* [*lat.*] *tib.* Metobolik prosesləri tənzimləyən hormonal dərmanlardan biri.

**PREFEKTÚRA** *is.* [*lat.*] 1. Qədim Roma imperiyasında inzibati bölgü.

2. İnzibati ərazi vahidi.

3. Ərazi vahidinin idarəetmə orqanı.

**PREFERÁNS** [*fr.*] Kart oyunlarından birinin adı. *Preferans oynamaq.*

**PREFİKS** [*lat.* praefixus – artırılmış] *qram.* Ön şəkilçi.

**PRELÜD** [*lat.*] 1. Musiqi əsərinə giriş.

2. Əsasən fortepiano üçün müəyyən quruluş forması olmayan müstəqil musiqi pyesi. *Şopenin prelüdləri.*

**PREMYÉRA** [*fr.* premiere – birinci] Pyes, opera, balet və s.-nin ilk tamaşası. *Yeni baletin premyerası.*

**PREPARÁT** [*lat.* praeparatus – hazırlanmış] 1. Tədqiqat, müşahidə və ya tədris məqsədi ilə hazırlanmış heyvan və ya bitki orqanizmi hissəsi. *Anatomik preparat.*

2. Tədqiqat üçün hazırlanmış kimyəvi maddə. *Radioaktiv preparat.*

3. Laboratoriya və ya fabrikdə hazırlanmış kimyəvi maddə və ya dərman. *Vitaminli preparatlar. Yodlu preparat.*

**PREPARATÇI** *is.* Preparat hazırlamaqla məşğul olan şəxs.

**PRES** [*lat.* presse – təzyiq] Materialları təzyiq vasitəsilə işləmək, emal etmək üçün maşın, qurğu; basqı aləti, məngənə, sıxac. *Əl presi. Ştamp presi. Hidravlik pres.*

**PRESLƏMƏ** "Presləmək"dən *f.is.*

**PRESLƏMƏK** *f.* Preslə basmaq, sıxmaq, təzyiq etmək; preslə işləmək, hazırlamaq; pres vasitəsilə emal etmək.

**PRESLƏNMİŞ** *f.is.* Pres vasitəsilə sıxılmış, basılmış. *Preslənmiş pambıq. Preslənmiş karton.*

**PRESLƏYİCİ** *is.* Presə, pres maşınına xidmət edən, presdə işləyən fəhlə.

**PREYSKURANT** *is.* [*alm.*] Yemək və xörək adlarını və onların qiymətlərini göstərən sənəd.

**PREZİDENT** [*lat.* praesidens – başçı, sədrlik edən] 1. Cəmiyyət və ya idarəyə rəhbərlik etmək üçün seçilmiş sədr. *Elmlər Akademiyasının prezidenti.*

2. Respublika idarə quruluşu olan ölkələrdə müəyyən müddətə seçilən dövlət başçısı.

**PREZİDENTLİK** *is.* 1. Prezidentin vəzifəsi, rütbəsi.

2. Prezidentin fəaliyyət dövrü; prezidentin fəaliyyəti. *Beş illik prezidentlik.* □ **Prezidentlik etmək** – prezident kimi fəaliyyət göstərmək, prezident vəzifəsini ifa etmək.

**PRİKAZ** [*rus.*] *tar.* XVI əsrdən XVIII əsrin əvvəllərinə qədər Rusiya dövlətində dövlət idarəsinin ayrıca sahəsinə baxan idarə. *Cari idarə işləri üçün xüsusi müəssisələr vardı ki, bunlara da prikazlar deyilirdi.*

**PRİMA-BALERİNA** [*ital.* prima – balerina] Baletdə əsas rolu ifa edən rəqqasə.

**PRİMİTİV** *sif.* [*lat.*] bax **ibtidai** 2-ci mənada.

**PRİMİTİVİZM** [*lat.*] 1. Hər hansı bir hadisəyə çox bəsit münasibət.

2. *inc.* XIX əsrdə – XX əsrin incəsənətində: primitivə – ibtidai sənət formalarına təqlid etmə, primitiv formalara qayıtma.

3. Primitivlik.

**PRİMİTİVLİK** *is.* İbtidailik, çox bəsitlik, çox sadəlik. *Alətlərin primitivliyi.*

**PRÍMUS** [*lat.* primus – ilk, ən yaxşı] Nefti odluğa vermək üçün nasosu olan qızdırıcı cihaz.

**PRİNSİP** [*lat.*] 1. Hər hansı bir nəzəriyyənin, təlimin, əqidənin, dünyagörüşünün, elmin və s.-nin əsas müddəası, çıxış nöqtəsi. *Təqib etdiyimiz məram və tutduğumuz prinsip bizim üçün müqəddəsdir.* M.İbrahimov. // Hər hansı bir işdə rəhbər ideya, əsas istiqamət, gözlənilməli olan şərt, əsas. *Könüllülük prinsipi.* // Bir şeyə daxili inam; nöqteyinəzər, xətti-hərəkət norması. *Onun prinsipi belədir.*

2. **Prinsipcə** şəklində *zərf* – əsasən, ümumiyyətlə, əsas etibarilə. *Prinsipcə razılaşmaq.*

**PRİNSİPİAL** [*lat.* principalis – əsas] 1. Prinsipə aid olan, prinsipdən çıxan. *Prinsipial sual. Prinsipial ziddiyyət.*

2. Prinsiplərə ciddi əməl edən, onlara əsaslanan, onlardan çıxış edən; prinsipli. *Prinsipial tənqid. Prinsipial siyasət. Prinsipial adam.*

**PRİNSİPİALLIQ** *is.* Sözdə və işdə ardıcıl surətdə müəyyən prinsipləri keçirmə, onlara ciddi riayət etmə. *Ədəbi, nəzəri tənqid ardıcıllıq, prinsipiallıq tələb edir.* S.Rəhimov.

**PRİNSİPLİ** *sif.* Prinsipə ciddi riayət edən, onu əsas götürən; prinsipial. *Prinsipli adam.* – *Qaratel inad və prinsipli idi.* Ə.Vəliyev.

**PRİNSİPSİZ** *sif.* Müəyyən prinsipi, dəyanəti olmayan. *Prinsipsiz adam.* // Zərf mənasında. [Şirzad Rüstəm kişiyə:] *Lakin böyüyə hörmət adamı prinsipsiz, simasız edirsə, belə hörmətdən əl çəkmək lazımdır.* M.İbrahimov.

**PRİNSİPSİZLİK** *is.* Sözdə və işdə prinsipin olmadığı hal.

**PRİORİTÉT** *sif.* [*alm.*] 1. Birincilik.

2. Müəyyən bir sahədə üstünlük təşkil edən.

**PRİPÍSKA** *is.* [*rus.*] 1. Əlavə yazma, artırma, olduğundan çox göstərmə.

2. Bilərəkdən saxtakarlıq etmə.

**PRÍSTAV** [*rus.*] İnqilabdan əvvəl Rusiyada: yerli polis rəisi. *Pristav, naçalnik gələndə kəndə; Obanı, oymağı vururlar bəndə.* Aşıq Ələsgər. [Mirzə Kərim:] *Naçalniklərə, pristavlara, yasavullara bel bağlamaq olmaz.* Ə.Haqverdiyev.

**PRİSTAVLIQ** *is. tar.* 1. Pristav vəzifəsi. *Bəli, vaxt oldu ki, şəhərdə pristavlıq yeri açıldı.* N.Nərimanov.

2. Pristav idarəsi, yerli polis idarəsi. *Pristavlıq qala düzündə "Dumun" yanında idi.* Mir Cəlal.

**PRİVAT-DOSENT** [*lat.* privatim docens – xüsusi yolla dərs deyən] 1917-ci il inqilabından əvvəl Rusiyada və Qərbi Avropa ölkələrində: ştatdankənar (Rusiyada: 1884-cü ildən həm də ştatda olan) ali məktəb müəllimінin alimlik adı, habelə belə adı olan şəxs.

**PRİZ** [*fr.*] Hər hansı bir yarışda qalib gələnə verilən mükafat. *İdmançılar böyük priz uğrunda yarışlarda qalib gələrək qızıl medal qazanmışlar.*

**PRİZÇİ** *is.* Priz almış yarış iştirakçısı. *Olimpiya oyunlarının prizçisi.* // Sif. mənasında. *Prizçi idmançı.*

**PRÍZMA** [*yun.*] 1. *riyaz.* İki üzü bərabər və uyğun tərəfləri paralel çoxbucaqlı, qalan üzlərinin hamısı paraleloqram olan çoxüzlü (cisim).

2. *fiz.* Mürəkkəb işığı spektrlərə ayırmaq, işıq şüalarının istiqamətini dəyişdirmək və b. məqsədlər üçün müxtəlif optik, spektral və başqa cihaz və aparatlarda işlədilən şəffaf maddədən qayrılmış həmin şəkildə cisim.

**PRİZMALI** *sif.* Prizması olan, prizma ilə təchiz edilmiş. *Prizmalı durbin.*

**PRİZMAŞƏKİLLİ** b a x **prizmavari**.

**PRİZMAVARİ** *sif.* Prizma şəklində olan.

**PROBKA** [*rus.*] 1. Ağzı girdə şüşə və s. qabların ağzını, aparat və cihazların deşiklərini qapamaq üçün rezin və s.-dən hazırlanmış tıxac.

2. Elektrik qoruyucularından birinin adı. *Sayğacın probkası yanmışdır.*

3. *məc.* Normal hərəkətə, gediş-gəlişə mane olan nəqliyyat və s.-nin bir yerə yığılıb durması. *Yolda probka əmələ gəlib.*

**PROBKALAMA** "Probkalamaq"dan *f.is.*

**PROBKALAMAQ** *f.* Probka ilə bağlamaq, tıxamaq. *Şüşənin ağzını probkalamaq.*

**PROBKALANMA** "Probkalanmaq"dan *f.is.*

**PROBKALANMAQ** *məch.* Probka ilə bağlanmaq, tıxanmaq. *Şüşə probkalandı. Qabın deşiyi probkalandı.*

**PROBLÉM** [*yun.* problema – vəzifə, tapşırıq] Həll olunmasını tələb edən nəzəri və ya əməli məsələ. *Tərbiyə problemi. Kadr problemi.* – "*Ayrılan yollar*" *..bir çox ictimai-əxlaqi problemlər ortalığa atır və onların bədii həllini verir.* M.İbrahimov.

**PROBLEMATİK** *sif.* [*yun.*] Sübut olunmamış, həll olunmamış, hələ problem kimi qalan. *Problematik məsələ.* // Şübhəli, ehtimalsız.

**PROBLEMATİKA** [*yun.*] Problemlər. *Elmi işlərin problematikası.*

**PROBLEMATİKLİK** *is.* Problematik məsələ və s.-nin xüsusiyyəti, problematik olma.

**PRODÚSER** *is.* [*ing.*] Filmlərin quruluşunu verən, kinostudiya rəhbəri.

**PROFESSİONAL** *sif.* [*yun.*] Müəyyən bir işi özünə peşə etmiş; peşəkar. *Professional idmançı. Professional rəssam.* – *Ərəblinski səhnə fəaliyyətinə başladığı gündən əsil sənətkar, professional aktyor olmaq üçün möhkəm bir istiqamət tutmuşdu.* Ü.Hacıbəyov. // İs. mənasında. *Professionalların sərgisi.*

**PROFÉSSOR** [*lat.* professor – tərbiyəçi] Ali məktəblərdə müstəqil kurs aparan ən ixtisaslı müəllimlərə, elmi tədqiqat müəssisələrində isə aspirantlara, elmi tədqiqat işlərinə rəhbərlik edən şəxsə verilən yüksək elmi ad, habelə belə adı olan şəxs. *Qoca professor oğlanın gözlərini diqqətlə müayinə etdi.* İ.Əfəndiyev.

**PROFESSORLUQ** *is.* Professorun işi, professor vəzifəsi.

**PROFESSURA** [*lat.*] 1. Professor adı, vəzifəsi.

2. *top.* Professorlar heyəti. *Universitet professurası.*

**PRÓFİL** [*ital.* profil] 1. Üzün və əşyanın yandan görünüşü. *Bu şəklin üst tərəfində hörükləri çiynindən döşünə doğru sallanan bir qız profili görünürdü.* M.Hüseyn.

2. *xüs.* Hər hansı bir sahənin, səthin və ya əşyanın eninə və ya uzununa şaquli kəsilişi. *Körpünün profili. Yolun profili.*

3. Təsərrüfatı, ixtisası, sənəti səciyyələndirən əsas tipik xüsusiyyətlərin məcmusu. *Ali məktəbin profili. Müəssisənin profili.*

**PROFİLAKTİK** *sif.* [*yun.*] Profilaktikaya aid olan, profilaktika məqsədi ilə görülən. *Profilaktik tədbir. Maşınların profilaktik təmiri.*

**PROFİLÁKTİKA** [*yun.* prophylaktikos – qoruyucu] 1. *tib.* Xəstəliyin qarşısını alan və əhalinin əmək və məişəti üçün sağlam şərait yaradan tədbirlərin məcmusu.

2. *tex.* Maşınların və b. texniki avadanlığın vaxtından qabaq xarab olmasının, köhnəlməsinin qarşısını almaq üçün görülən tədbirlər. *Avtomaşının təmiri və profilaktikası.*

**PROFİLAKTORİ** [*yun.*] Sanatoriya tipli müalicə müəssisəsi. *Gecə profilaktorisi.*

**PROGİMNAZİYA** [*rus.*] 1917-ci il inqilabından əvvəl Rusiyada: oğlan və ya qızlar üçün natamam orta məktəb. *Yeni təhsil ili başlananda progimnaziyada azərbaycanlı tələbələrin sayı otuz beşə çatdı.* A.Şaiq.

**PROJEKTOR** [*fr.* projecteur, əsli *lat.* projectio – irəli atılmış] İstənilən tərəfə paralel işıq şüaları salan güclü işıqlandırıcı cihaz. [M.Qorki] *xitabət kürsüsünə qalxdığı zaman hər tərəfdən projektorları ona tərəf yönəltdilər.* M.Hüseyn.

**PROJEKTORÇU** *is.* Projektorlarla işləyən, projektoru idarə edən şəxs.

**PROKÁT** [*rus.*] *tex.* Metalı fırlanan vallar arasında sıxmaqla emal etmə. *Boru prokatı.*

**PROKATÇI** *is.* Prokat sexində işləyən fəhlə.

**PROKRİPSİYA** *is.* [*lat.*] Qədim Romada rəsmi şəkildə qanundankənar elan edilmiş şəxslərin siyahısı.

**PROKURÓR** [*lat.* procurare – qayğısına qalmaq] 1. Qanunların dəqiq və dürüst yerinə yetirilməsi üzərində dövlət nəzarətini həyata keçirən vəzifəli şəxs. *Rayon prokuroru. Prokurorun sanksiyası.*

2. Məhkəmə prosesində dövlət ittihamçısı. *Məhkəmə sədri, üzvləri və prokuror daxil oldular.* H.Nəzərli.

**PROKURORLUQ** *is.* 1. Qanunların yerinə yetirilməsinə nəzarət edən və qanunu pozanları məsuliyyətə cəlb edən dövlət orqanı. *Rayon prokurorluğu.*

2. Prokuror vəzifəsi, prokuror vəzifəsini ifa etmə.

**PROQNÓZ** [*yun.* prognosis] Əldə olan elmi dəlillərə əsasən hər hansı bir hadisənin gələcək inkişafı və nəticəsi haqqında fikir söyləmə. // *tib.* Xəstəliyin gedişindəki bütün məlumatlara əsasən onun nəticəsi haqqında fikir söyləmə. □ **Hava proqnozu** – meteoroloji məlumatlara əsasən havanın necə olacağı haqqında qabaqcadan söylənilən fikir, məlumat.

**PROQRÁM** [programma – elan, sərəncam] 1. Görüləcək iş, fəaliyyət və s.-nin planı. *Sənayeni inkişaf etdirmək proqramı.*

2. Siyasi partiyanın, yaxud hər hansı bir siyasi və ya ictimai xadimin öz qarşısına qoyduğu məqsəd və məramı şərh edən bəyanatı. *Milli hökumət birdən-birə öz proqramını həyata keçirməyə başlaya bilmədi.* M.İbrahimov. // *xüs.* Avtomatik hesablama maşınlarının görəcəyi, həll edəcəyi məsələlərin planı. *Elektron hesablayıcı maşının proqramı.*

3. Bir işin həyata keçirilməsinin ardıcıllığı, sırası, planı. *Nümayiş proqramı. Bayram şənliklərinin proqramı.*

4. Konsertdə, sirk tamaşasında və s.-də ifa olunan nömrələrin, əsərlərin məcmusu, toplusu; radio və televiziya verilişlərinin tərkibi. *Konsertin proqramı. Televiziya verilişlərinin proqramı.*

5. Məktəblərdə tədris olunan fənn və ya kursun məzmun və metodoloji əsaslarının qısaca şərhi. *Tarix proqramı. Onuncu sinfin ədəbiyyat proqramı.* // Hər hansı bir məktəbdə, fakültə və ya kursda tədris olunan fənlərin məcmusu, toplusu. *Orta məktəb proqramı. Filoloji fakültənin proqramı.*

6. Çap olunmuş hər hansı bir kitabın, ədəbi əsərin planı, qısa məzmunu. *Romanın proqramı.* // Musiqi əsərinin mövzusu, süjeti.

**PROQUL** [*rus.*] Üzürsüz işə gəlməmə, işə çıxmama; işburaxma.

◊ **Məcburi proqul** – qanunsuz olaraq işə buraxılmadığına görə vəzifəsini yerinə yetirə bilməmə.

**PROQULÇU** *is.* Üzürsüz işə çıxmayan, proqul edən işçi; işburaxan.

**PROLETAR** [*lat.*] 1. Müasir cəmiyyətdə əsas siniflərdən biri, muzdlu fəhlə; fəhlə sinfi. *Proletar sinfi. – Bir qolumuz oldu; bir də ki zindan; Tarix proletar ad verdi bizə.* S.Vurğun.

2. *köhn.* Yoxsul, heç bir mülkiyyəti olmayan adam.

**PROLETARİAT** [*lat.* proletarius] b a x **proletar** 1-ci mənada.

**PROLETARLAŞDIRMA** "Proletarlaşdırmaq"dan *f.is.*

**PROLETARLAŞDIRMAQ** *t-li.* Muzdlu fəhləyə, proletara çevirmək; yoxsullaşdırmaq.

**PROLETARLAŞMA** *f.is.* Kapitalizm şəraitində xırda əmtəə istehsalçıları (kəndlilərin, sənətkarların, kustarların və b.) labüd olaraq müflisləşib yoxsullaşması və proletarlara çevrilməsi.

**PROLETARLAŞMAQ** *f.* Muzdlu fəhləyə, proletara çevrilmək.

**PROLÓQ** [*yun.* pro – ön və logos – söz, nitq] Ədəbi və ya musiqi əsərinin giriş hissəsi.

**PROPELLER** [*lat.* propellere – irəli itələmək] Təyyarə, aeroxizək, qlisser və s.-ni hərəkətə gətirən hava vinti; pər.

**PRORÉKTOR** [*lat.* pro – yerində, əvəzində və rector – rəhbər] Rektorun müavini, köməkçisi.

**PROSES** [*lat.* processus – gediş] 1. Hər hansı bir hadisənin gedişi. *Bitkinin inkişaf prosesi*. // Müəyyən nəticə əldə etmək məqsədilə görülən ardıcıl işlərin məcmusu. *Texnoloji proses. Neftçıxarma prosesi*.

2. Xəstəliyin aktiv inkişafı, gedişi. *İltihab prosesi*.

3. *hüq*. Məhkəmədə işlərə baxılma qaydası, mühakimə üsulu. *Mülki proses*.

**PROSESSUÁL** *sif.* [*lat.*] *hüq*. Prosesə aid olan, proseslə (3-cü mənada) əlaqədar olan. *Prosessual məcəllə*.

**PROSKRÍPSİYA** *is.* [*lat.*] Qədim Romada rəsmi şəkildə qanundan kənar elan edilmiş şəxslərin siyahısı.

**PROSPEKT[1]** [*lat.* prospectus – görünüş, mənzərə] Şəhərdə böyük enli və düz küçə. *Nərimanov prospekti*.

**PROSPEKT[2]** [*lat.*] Gələcək elmi əsərin, dərsliyin, məcmuənin və s.-nin müfəssəl planı. *Kitabın prospekti*. // Vərəqə və ya kitabça şəklində reklam.

**PROSTÁT** *is.* Kişilərdə cinsiyyət vəzisi.

**PROTEÍN** *is.* [*yun.*] Sadə zülal.

**PROTEKTORÁT** [*lat.*] Güclü dövlətin zəif dövləti özünə tabe etmə formalarından biri (belə bir şəraitdə tabe ölkə öz dövlət quruluşunu saxlasa da, əslində müstəqilliyini tamamilə itirmiş olur).

**PROTESTANT** [*lat.* protestans – etiraz edən] Protestantlığa (protestantizmə) mənsub olan, ona etiqad edən adam.

**PROTESTANTÍZM** [*lat.*] XVI əsrdə katolisizmə protest əlaməti olaraq reformasiya ilə əlaqədar əmələ gələn müxtəlif xristian məzhəblərinin ümumi adı; protestantlıq.

**PROTESTANTLIQ** b a x **protestantizm**.

**PROTEZ** [*yun.* prothese – əlavə etmək, birləşdirmək] Bədənin itirilmiş hissəsini əvəz etmək üçün onun formasında düzəldilmiş süni üzv. *Diş protezi*.

**PROTEZÇİ** *is.* Protez qayıran, protez hazırlayan mütəxəssis.

**PROTEZLƏMƏ** "Protezləmək"dən *f.is.*

**PROTEZLƏMƏK** *f. xüs*. Protezlə təmin etmək, itirilmiş bədən üzvünü protezlə əvəz etmək, protez qayırmaq.

**PROTOKÓL** [*yun.* protokollon] İclasda, müşavirədə, istintaqda və s.-də baş verən hadisələrin qeydiyyatının, görülən işlərin və qərarların yazıldığı sənəd. *İclasın protokolu. – Qədirin iştirak etdiyi elə iclas yox idi ki, protokolun ayağında qətnaməyə zidd gedən olmasın.* Mir Cəlal. // Hər hansı bir faktı, hadisəni təsdiq edən sənəd. *Haman saat kənd Şurası sədri gəlib protokol yazdırdı*. T.Ş.Simurq.

**PROTÓN** [*lat.* protos – birinci] *fiz*. Oksigen atomunun nüvəsi olan və bütün maddələrin atom nüvəsinin tərkibinə daxil olan müsbət elektrik yüklü hissəcik.

**PROTOPLÁZMA** [*yun.*] *biol.* Heyvan və bitki orqanizmləri hüceyrələrində gedən həyat proseslərinin əsasını təşkil edən maddə.

**PROTOTÍP** [*yun.*] 1. *ədəb*. Ədəbi surət, habelə qəhrəman obrazı yaratmaq üçün müəllifin orijinal kimi istifadə etdiyi həqiqi şəxs. *Babək* "*Od gəlini*"*ndəki Elxanın prototipidir*.

2. Sonra gələn bir şəxsin və ya şeyin sələfi olan şəxs, ya şey.

**PROVİZOR** [*lat.* provisor – əvvəlcədən görən] Yüksək ixtisaslı aptek işçisi; əczaçı.

**PROVİZORLUQ** *is.* Provizorun işi; əczaçılıq.

**PROVOKÁSİYA** [*lat.*] Ayrı-ayrı şəxsləri, yaxud qrupları, təşkilatları və ya ölkələri onların özləri üçün təhlükəli olan, bəzən də onların məhvinə səbəb ola bilən bir işə təhrik etmə: fitnəkarlıq, fitnə, araqarışdırma. // Gizli polis agentlərinin inqilabi təşkilatlara soxularaq onları pozmaq və dağıtmaq məqsədilə onların daxilində apardıqları xəyanətkarlıq və fitnəkarlıq işi.

**PROVOKÁTOR** [*lat.*] 1. Provokasiya vasitəsilə iş görən polis casusu. *Çar xəfiyyəsinin provokatoru*.

2. Təhrikçi, fitnəçi, fəsadçı.

**PROVOKATORLUQ** *is.* Fitnəçilik, fəsadçılıq, təhrikçilik.

**PROYÉKSİYA** [*lat.* projectio – irəli tullama] *riyaz.* Hər hansı bir şeyin müstəvi üzərində təsviri. *Xəttin proyeksiyası.*

**PROZÉKTOR** [*lat.* prosector – yaran, parçalayan] Xəstəxananın patoloji anatomiya şöbəsinə rəhbərlik edən həkim. ◻ **Prozektor otağı** – klinika və xəstəxanada meyit yarılan yer (otaq).

**PRUSSAKLAR** *cəm* Keçmiş alman əyaləti Prussiyada doğulmuş və ya yaşamış xalq; şimal-şərq almanları.

**PSİXÉYA** *is.* [*yun.*] Qədim yunan mifologiyasında insan qəlbinin mücəssəməsi; bir qayda olaraq, kəpənək və ya qız şəklində təcəssümü.

**PSİXİ** *sif.* [*yun.* psyche] Ruhi.

◊ **Psixi hücum** – düşmənin (müqabil tərəfin) psixikasına təsir etmək, onun iradəsini qırmaq, sıralarını pozmaq, qorxutmaq məqsədilə edilən hücum.

**PSİXİÁTR** [*yun.*] Ruhi xəstəliklər həkimi.

**PSİXİATRİK** *sif.* [*yun.*] Ruhi xəstəliklərlə əlaqədar olan. *Psixiatrik müalicəxana.*

**PSİXİATRÍYA** [*yun.* psyche və iatreia] Ruhi xəstəliklər və onların müalicə üsullarından bəhs edən elm.

**PSİXÍKA** [*yun.*] 1. Beyinin xarici aləmi əksetdirmə xassəsi.

2. Psixi xüsusiyyət, xarakter xüsusiyyət, ruhi hal, əhval-ruhiyyə.

**PSİXOLÓGİYA** [*yun.*] 1. İnsanın psixikasından, psixi fəaliyyətinin proses və qanunauyğunluqlarından bəhs edən elm. *Ümumi psixologiya. Patoloji psixologiya. Təcrübi psixologiya.* // Bu elmin məzmununu təfsir edən fənn. *Psixologiya dərsi. Psixologiya müəllimi.* // Bu elmin məzmununu şərh edən kitab. *Psixologiyadan dərslik.*

2. Psixi xüsusiyyətlərin məcmusu, ruhi hal; psixika, əhval-ruhiyyə. *Şagirdlərin psixologiyası. Kütlənin psixologiyası. Uşağın psixologiyasına təsir etmək.*

**PSİXOLOJİ** *sif.* [*yun.*] 1. Psixologiyaya aid olan, psixologiya ilə bağlı olan. *Psixoloji təcrübə.*

2. İnsanın psixoloji fəaliyyəti ilə bağlı olan. *Məsələnin psixoloji tərəfi.*

3. Təsvir olunan surətlərin psixologiyasının dərin təsviri əsasında qurulmuş, yaradılmış. *Psixoloji drama. Psixoloji roman.*

**PSİXÓLOQ** [*yun.*] 1. Psixologiya mütəxəssisi.

2. İnsan psixologiyasının incəliklərini yaxşı bilən, həssas adam.

**PSİXOPÁTİYA** [*yun.*] Ruhi fəaliyyətin pozulması; ruhi xəstəlik.

**PSİXOPATOLÓGİYA** [*yun.* psycho, pathos və logos] 1. Ruhi xəstəliklər haqqında ümumi elm; psixiatriya.

2. Ruhi cəhətdən qeyri-normallıq.

**PSİXOPATOLOJİ** *sif.* [*yun.*] Psixopatologiya ilə əlaqədar olan, psixopatologiyaya aid olan. *Psixopatoloji tədqiqat.*

**PSİXOPATÓLOQ** [*yun.*] Psixopatologiya mütəxəssisi.

**PSİXOTERAPÉVT** [*yun.*] Psixoterapiya mütəxəssisi olan həkim.

**PSİXOTERAPEVTİK** *sif.* [*yun.*] *tib.* Psixoterapiyaya, psixoterapevtə aid olan. *Psixoterapevtik müalicə üsulları.*

**PSİXOTERAPÍYA** [*yun.*] Xəstəyə psixi təsir (məs.: hipnoz, söhbət) vasitəsilə müalicə üsulu.

**PSİXÓZ** [*yun.*] Ruhi xəstəlik, ümumiyyətlə, insan psixikasında anormallıq, qəribəlik.

**PUBLİSÍST** [*lat.*] İctimai-siyasi mövzuda əsərlər yazan yazıçı; mühərrir. *Böyük realist sənətkar olan N.Nərimanov eyni zamanda ehtiraslı bir publisistdir.* M.Arif.

**PUBLİSİSTİK** *sif.* [*lat.*] Publisistikaya aid olan. *Publisistik əsər. Publisistik məqalə.*

**PUBLİSÍSTİKA** [*lat.* publicus – ictimai] 1. Müasir aktual mövzuda yazılmış ictimai-siyasi əsərlərin daxil olduğu ədəbi janr. *Cəlil Məmmədquluzadə dramaturgiya və publisistikada olduğu kimi nəsrdə də hər şeydən əvvəl tənqidi realist bir sənətkardır.* M.İbrahimov.

2. *ədəb.* Həmin janrda yazılmış əsərlər. *Üzeyir Hacıbəyovun publisistikası.*

**PUÇ** *sif.* 1. İçi xarab olmuş, ləpəsi quruyub yeyilməz hala düşmüş. *Puç fındıq* (*qoz, badam*).

2. *məc.* Boş, heç, fani, axırı olmayan. *Ey Vidadi, sənin bu puç dünyada; Nə dərdin var ki, zar-zar ağlarsan?* M.P.Vaqif. *Həyatın*

*mənası çalışmaqdadır; Əməksiz bir ömür puçdur, saxtadır*. R.Rza. □ **Puç etmək (eyləmək)** – məhv etmək, puça çıxarmaq, heç etmək, heçə çıxarmaq. [Hacı Nuru şair:] *Sənin atan usta Rəhman dəllək, ülgüc, bülöv ilə məqul dövlət qazandı, sənsə puç etdin*. M.F.Axundzadə. *Puç eylədin, övrət, bu gözəl, sadə insanı!* M.Ə.Sabir. [Xədicə:] *Necə ağlamayım ki, illər ilə bəslədiyim məhəbbəti ruzigar puç etmək istəyir*. N.Nərimanov. **Puç olmaq** – məhv olmaq, puça çıxmaq, heç olmaq. *Amma elə ki,* [Əmiraslanın] *var-yoxunun hamısı eyş-işrətə qoyulub puç oldu, Gülpərini almaq fikrinə düşdü*. S.S.Axundov. [Şahmar:] *Mənim arzularım, gör necə puç oldu, kül kimi göyə sovruldu!* B.Bayramov. **Puça çıxarmaq** – b a x **puç etmək**. *Düşmənin məftil hasarını dağıtmaq, puça çıxarmaq vəzifəsini Fərhadın vzvoduna tapşırılmışdı*. Ə.Vəliyev. **Puça çıxmaq** – b a x **puç olmaq**. *Bu il çox yerlərdə quraqlıq keçir və əkinlər susuzluqdan yanıb puça çıxır...* C.Məmmədquluzadə. *Şahpərinin ümidi də puça çıxdı*. B.Bayramov.

**PUÇAL** *is.* Cecə, torta.

**PUÇUR** *is.* 1. Tumurcuq. *Mən sakitcə dayanıb ağaca baxır, puçurlarına .. diqqət edirdim*. Mir Cəlal.

2. *dan.* Damcı-damcı axan tər, tər damcıları. *Səhər keçir hücuma, puçur tərə batırsan..* M.Rahim.

**puçur-puçur** *sif.* Damcı-damcı, damla-damla. *Alnında titrər; Puçur-puçur tər; Nə yazsa azdır; Min sinədəftər*. S.Vurğun. □ **Puçur-puçur tər tökmək** – işləməkdən, istidən və ya xəcalətdən tər tökmək. [Səməd:] *Adamla üz-üzə duranda* [gəlin] *puçur-puçur tər tökür*. İ.Hüseynov.

**PUÇURLAMA** "Puçurlamaq"dan *f.is.*

**PUÇURLAMAQ** *f.* 1. Tumurcuqlamaq. *Pəncərənin önündə bir ağac puçurladı; Yarpaq açdı aram-aram*. N.Rəfibəyli. [Fərəcov:] *Bir yaz gəlsin, tənəklər puçurlayıb yamyaşıl yarpaq açsın, gör nə tamaşa olacaq!* B.Bayramov.

2. Damcılar şəklində görünmək, damcı-damcı çıxmaq (tər). *Şair gülümsəyir baxıb Sarvana; Sarvanın alnında puçurlayır tər*. H.Arif.

**PUÇURLANMA** "Puçurlanmaq"dan *f.is.*

**PUÇURLANMAQ** 1. B a x **puçurlamaq** 1-ci mənada. *Hava yavaş-yavaş işıqlanırdı, torağaylar uçuşub yeni-yeni puçurlanan* (f.sif.) *ağacların çılpaq budaqlarına qonurdu*. M.Hüseyn.

2. B a x **puçurlamaq** 2-ci mənada. *Mahmud, alnında puçurlanmış* (f.sif.) *tər damlalarını silib özünü topladı*. Y.Əzimzadə.

**PUD** [*rus.*] Metrik ölçü sistemindən əvvəl işlədilmiş, 16,4 kq-a bərabər ağırlıq ölçüsü. *Mirzənin zamanında ucuzluq idi, yaxşı qoyun ətinin girvənkəsi dörd qəpik, çörəyin girvənkəsi iki qəpik, yağın pudu dörd manat idi*. Ə.Haqverdiyev. [Yusif Şahmara:] *Azar-bezardan qorusan, bu xırdaca tənək iki pud üzüm verər*. B.Bayramov.

**PÚDİNQ** *is.* [*ing.*] Un və ya düyü unu, yumurta, süd, kişmiş və ədviyyatlardan hazırlanan milli ingilis yeməyi.

**PUDLİNQ** *is.* [*ing.*] Çuqundan dəmir hazırlanmasının köhnə üsulu.

**PUDLUQ** *is. köhn.* 1. Bir pud ağırlığında çəki daşı. *Pudluğu tərəziyə qoymaq*.

2. Saylardan sonra gələrək şeyin neçə puddan ibarət (neçə pud ağırlığı) olduğunu bildirir. *İbiş hər gün on pudluq çəlləyini doldurmasaydı ürəyi dincəlməzdi*. S.Vəliyev. [Zeynal:] *Kişi beş pudluq cöngə kəsib*. Ə.Əbülhəsən.

**PÚDRA** [*fr.*] Gigiyenik və ya kosmetik məqsədlə işlədilən (üzə sürtülən) nişasta və s. maddələrdən hazırlanmış çox narın, yumşaq, adətən ətirli toz. *Üzünə pudra sürtmək*. – *Pudradan, boyadan xoşlanmaz Xumar; Onun qəlbi qədər sadəliyi var*. S.Vurğun.

**PUDRAQABI** *is.* Pudra üçün kiçik qutu.

**PUDRALAMA** "Pudralamaq"dan *f.is.*

**PUDRALAMAQ** *f.* Pudra vurmaq, pudra sürtmək. *Xanım əvvəlki kimi tualetinə məşğul idi: gözəl geyinmişdi, üzünü pudralayırdı*. Çəmənzəminli. *Dəllək müştərisinin üzünü pudralayıb sildi*. M.Hüseyn.

**PUDRALANMA** "Pudralanmaq"dan *f.is.*

**PUDRALANMAQ** *qayıd.* Üzünə pudra sürtmək. [Tələbə:] *Pudralanıb bayıra çıxdım*. Qantəmir. *Cənnət xanım güzgü qabağında dayanıb pudralanırdı*. Mir Cəlal.

**PUDRALI** *sif.* Üzünə pudra sürtmüş; pudralanmış. *Mənim nazlı yarımın pudralı ca-*

*malı var; Boyalıdır saçları, iki yapma xalı var*. H.Cavid.

**PUF** *is. zool.* Yumurtadan təzəcə çıxmış cücü. *Məktəblilər cərgələr arasını gəzərkən hər bir yarpağı qaldırıb baxır, yumurtaları və pufları balaca qutulara, bankalara yığırdılar*. Ə.Vəliyev.

**PUL** *is.* 1. Alğı-satqı vaxtı qiymət ölçüsü kimi işlədilən metal və ya kağız parçası; bank bileti; ağca. *Kağız pul. Xırda pul. – Yusif əmi hazır elədiyi pulu verib dedi ki, dəxi bundan savayı pulumuz yoxdur*. C.Məmmədquluzadə. ☐ **Pul çıxarmaq** – pul əldə etmək, gəlir götürmək. *Hər şeydən pul çıxarmaq*. **Pul dartmaq (qoparmaq)** – birisindən hər hansı bir yolla pul almaq və ya pul çəkməyə çalışmaq. **Pul eləmək** – satıb pula çevirmək, əvəzində pul almaq. *İbrahim atın çıxartdı bazara, satdı, pul elədi*. (Nağıl). **Pul kəsmək** – metal pul zərb etmək, kağız pul kəsmək. **Pul qoymaq** – hər hansı bir məqsədlə çoxlu pul xərcləmək. [Pəri:] *Gərək lazım gələcək qədər pul qoyub* [Gülnisəni] *xilas edəm*. C.Cabbarlı. **Pul tökmək** – çoxlu pul xərcləmək, pul qoymaq. *..Qızının sağalması üçün pul tökməyə, hətta var-yoxundan çıxmağa hazır idi*. Ə.Abasov. **Pul yemək** – özünə tapşırılmış pulu mənimsəmək. *Biri nəvvadeyi-dəllək Səfər, adı Sultan; Pul yeməkdən ötəri taki olubdur deptat*. S.Ə.Şirvani. [Məşədi İbad:] *Bəs bu nə kələkdir ki, Rüstəm bəy .. mənim başıma gətirir, özü də hələ mənim beş min manat pulumu yeyibdir*. Ü.Hacıbəyov. **Pulunu cibinə qoymaq** *məc.* – sataraq pul hasil etmək, nağd pula çevirmək. *..Biz Allaha deyirik ki, biz sənə ibadət elədik, sən də bizə yağış göndər ki, pambıqlarımızı suvaraq və pambığı sataq, pulunu qoyaq cibimizə*. C.Məmmədquluzadə.

2. Kapital, dövlət, sərvət. *Xudayar bəyin qəsdi Zeynəbin və səğirlərin var-yoxuna, puluna və mülkünə sahib olub Zeynəbi çölə ötürmək idi*. C.Məmmədquluzadə. [Mərcan bəy:] *Pulun ola, malın ola, amma arvad sənə göz verə, işıq verməyə?* Ü.Hacıbəyov.

3. Bəzən balıqların üzərindəki sədəf kimi parlaq pərəklər, pulcuqlar; ağca. *Balığın pulunu təmizləmək*.

◊ **Pula dönmək** – qıpqırmızı olmaq, bərk qızarmaq. **Pultək (kimi) qızarmaq (olmaq)** – xəcalətdən, utanmaqdan üzü bərk qızarmaq, qıpqırmızı olmaq. *Xəcalətindən pul kimi oldu. – Kargüzar qız pul kimi qızarıb istər-istəməz yazmağa başladı*. S.Rəhimov. *Utandığındanmı, xəcalət çəkdiyindənmi başını yuxarı qaldıra bilmirdi. Sifəti pul kimi qızarmışdı*. Ə.Vəliyev.

**PULCUQ** b a x **pul** 3-cü mənada. *Balıqların əksəriyyətində bədənin üzəri pulcuqlarla örtülü olur*. Y.Əbdürrəhmanov.

**PULCUQLU** b a x **pullu** 3-cü mənada. *Gümüş pulcuqlu balıq*.

**PULEMYOT** [*rus.* пулемёт] Güllə atan avtomatik silah. *Dəzgahlı pulemyot. Əl pulemyotu*. – [Qəhrəman:] *Mən burada dörd nəfər yoldaşım və bir pulemyot ilə həm körpünü, həm də meydanı yaxşıca atəşə tuta bilərdim*. H.Nəzərli. *Pulemyotların qaqqıltısı meşədəki uğultunu susdurmuşdu*. Ə.Vəliyev.

**PULEMYOTÇU** *is.* Pulemyotdan atəş açan əsgər. *Cavad atəş yağmuru altında irəlilədikdə sağ cinahı qoruyan pulemyotçu əsgəri yaraladılar*. Ə.Vəliyev.

**PULGİR** b a x **pulpərəst**.

**PULGİRLİK** b a x **pulpərəstlik**.

**PULLANMA** "Pullanmaq"dan *f.is.*

**PULLANMAQ** *f.* Çoxlu pul qazanmaq; varlanmaq, dövlətlənmək. [Hacı Nuru şair:] *İndi istəyirsən ki, bir yalançı kimyagərin dövlətindən birdən pullanasan*. M.F.Axundzadə.

**PULLU** *sif.* 1. Varlı, dövlətli, zəngin. *Pullu adam*. – [Molla Salman:] *Əyərçi nəqd pulunuz yoxdur, amma mən pullu Hacı Rəhim ilə dostam..* M.F.Axundzadə. [Həmzə:] [Siratın] *birinci düşməni pullu qohumlarıdır*. Ə.Əbülhəsən. // İs. mənasında. *Şeyxə, bəyə, pulluya sarmaşmayın; Qışdı deyib, bunca qırıldaşmayın*. Ə.Nəzmi.

2. Əvəzində pul verilən (alınan), pulla olan. *Pullu məktəb. Pullu tamaşa*.

3. Üzərində pul (3-cü mənada) olan, pulla örtülü; pulcuqlu, ağcalı. *Pullu balıq*.

**PUL-MUL, PUL-PARA, PUL-PƏNƏ** *top. dan.* Az miqdarda pul. [Hümmətəliyə] *oğlu Səməd də arabir puldan-paradan yollayırdı*. M.Hüseyn. [Kərbəlayı Pirverdi:] *Alimin buyurduğuna görə biz gərək sənə puldan-pənədən yığıb verək*. Qantəmir.

**PULÓVER** *is.* [*ing.*] Yaxalıqsız və düyməsiz toxunma köynək.

**PULPƏRƏST** *sif.* və *is.* [*fars.*] Pulu həddindən artıq sevən, pulgir, pul düşkünü. *Pulpərəst adam. – Pirverdi ağır təbiətli, çalışqan olmaqla bərabər, son dərəcə pulpərəst və xəsis bir adam idi.* A.Şaiq.

**PULPƏRƏSTLİK** *is.* Həddindən artıq pula aludəlik, pul düşkünlüyü.

**PUL-PUL** *zərf* Xırda pul kimi. ◻ **Pul-pul olmaq** – 1) xırda-xırda doğranmaq, tikə-tikə olmaq, parçalanmaq; sınmaq. *Kərpic yarı yoldan yerə düşüb pul-pul oldu.* S.Rəhimov. *Avtomobilin şüşələri pul-pul olub yerə töküldü.* P.Makulu; 2) qızarmaq (istidən, xəcalətdən, hirsdən və s.-dən). *Üzü pul-pul olub.*

**PULSUZ** *sif.* 1. Əvəzində pul almadan; havayı, məccani. *Pulsuz tamaşa. Pulsuz yemək.* // Zərf mənasında. *Pulsuz işləmək. Pulsuz oxumaq.*

2. Pulu olmayan; kasıb, yoxsul. *Pulsuz adam. – Pulsuz kişi, insanlığı asanmı sanırsan?!* M.Ə.Sabir.

**PULSUZLAMA** "Pulsuzlamaq"dan *f.is.*

**PULSUZLAMAQ** *f.* Pulu qurtarmaq, pulu olmamaq, kasıblaşmaq, yoxsullaşmaq. *Hələ cavan vaxtlarında Molla Nəsrəddin yaman pulsuzlayır..* "M.N.lətif."

**PULSUZLUQ** *is.* Kasıblıq, yoxsulluq; pulu olmayan adamın halı. [Məşədi İbad:] *Pul elə şeydir ki, qocanı eylər cavan və pulsuzluq da cavanı qoca eylər.* Ü.Hacıbəyov.

**PULSUZ-PARASIZ** *sif. dan.* Pulsuz. *Pulsuz-parasız adam. // Zərf mənasında.* Havayı, məccani, pulsuz. *Çox adamın inanmağı gəlmirdi ki, lütün birinə pulsuz-parasız torpaq verələr.* Mir Cəlal.

**PULT** [*alm.*] 1. Uca ayaqlar üstə duran maili çərçivə şəklində not altlığı. *Dirijor pultu.*

2. *tex.* Bir şeyi uzaqdan avtomatik idarə etmək üçün üstündə cihazlar qurulmuş, xüsusi stol, stend və s. şəklində qurğu. *Ekskavatorun idarə pultu.*

**PULVERİZÁTOR** [*fr.*] Mayeni hava təzyiqi ilə toz halına salıb səpələmək üçün cihaz.

**PUNKTÍR** [*lat.* punctum – nöqtə] Nöqtə və ya kiçik cızıqlardan ibarət qırıq xətt. *Punktir çəkmək.*

**PUNKTİRLƏMƏ** "Punktirləmək"dən *f.is.*

**PUNKTİRLƏMƏK** *f.* Punktir çəkmək, punktirlə işarə etmək.

**PUNŞ** [*ing.* punch] Şərabla su, qənd, limon və ya başqa meyvə şirəsindən hazırlanan, isti və ya soyuq içilən tünd içki.

**PURGÉN** *is. tib.* İşlətmə dərmanlar qrupundan dərman preparatı.

**PURİST** [*lat.*] Purizm tərəfdarı.

**PURÍZM** [*lat.* purus – təmiz] Dili xarici sözlərdən təmizləmə cəhdi, ümumiyyətlə, dili yeni sözlərdən – neologizmlərdən, təhriflərdən və s.-dən təmizləmə cəhdində ifrata varma.

**PUSQU** *is.* 1. Bir yerdə gizlənib adamı və ya ovu pusma, güdmə, gözləmə; marıq. *Aslan həmişə pusquda idi ki, görək nə vaxt buna bir dilənçi rast olacaq.* İ.Musabəyov. ◻ **Pusquda durmaq (dayanmaq)** – gizlənib adamı və ya ovu güdmək; pusmaq, gözləmək; marığa durmaq. *Kəngərli Həsrətlə Qüdrətin pusquda dayandığını zənn edib, geri qayıtmaq istədikdə Qaçay dilləndi..* Ə.Vəliyev. [Yaşarın] *atası bir kərə tülkünü vurmaq üçün pusquda durmuşdu.* M.Rzaquluzadə. **Pusquya yatmaq** – b a x **pusquda durmaq (dayanmaq)**. [Əmiraslan ağa:] *Qayadibi kəndinin arxasında pusquya yatarsan.* S.S.Axundov.

2. Adamı və ya ovu güdmək, gözləmək, pusmaq üçün gizlənilən yer, marıq yeri, pusqu yeri. *Elə ki, Əhməd tacirbaşının karvanı gəlib çatdı, dəlilər pusqudan çıxıb kəsdilər başlarının üstünü.* "Koroğlu". *Məşədi Əsgər öz pusqusundan çıxıb yenə çamadanın yanına gəldi.* S.M.Qənizadə.

**PUSQUÇU** *is.* Pusquda duran, güdən, gözləyən, pusan adam. [Şölə xanım:] *Özün bilmirsən ki, Ziba xanım yüz yerdə pusquçu qoyubdur ki, bu səbəblə səni ölümə verib bizi bədnam etsin.* M.F.Axundzadə.

**PUSMA** "Pusmaq"dan *f.is.*

**PUSMAQ** *f.* Gizlincə üzərində göz olmaq, gözdən qoymamaq; güdmək. [Mərcan bəy:] *Dur gedək o biri otağa, burada bizi pusarlar.* Ü.Hacıbəyov. *Uzaqdan bir kölgə onları* [Səlim və Mehribanı] *pusur, gizlicə təqib edirdi.* S.Hüseyn.

**PUSULMA** "Pusulmaq"dan *f.is.*

**PUSULMAQ** *məch.* Gizlincə üzərində göz qoyulmaq; güdülmək.

**PUTYOVKA** [*rus.*] 1. Bir yerə (məs.: sanatoriyaya, istirahət evinə, kursa və s.) göndərilən adama verilən rəsmi vəsiqə; yol vərəqəsi. [Gənclərin] *içlərində .. putyovka ilə gəlmiş texnikum və ali məktəb tələbələri də çoxdur.* M.İbrahimov. [Cavadov] *kassanı açıb, putyovkaları* [Sərdarlıya] *uzatdı.* Q.İlkin.

2. *xüs.* Sürücüyə, şoferə və b. verilən və nəqliyyatın marşrutu və görəcəyi işi göstərilən vərəqə. *Sürücünün putyovkasını yoxlamaq.*

**PÜF** *təql.* İstidən, yorğunluqdan, ürək sıxıntısından bezmiş adamın dodaqlarını aralayaraq ağzından havanı buraxarkən çıxardığı səs. [Mərcan bəy:] *Vallah, arvadın vəhmi məni basıbdır. Püf! Nə istidir!* Ü.Hacıbəyov.

**PÜFƏ** *uş.* Xörək, yemək, bişmiş.

**PÜFKÜRMƏ** "Püfkürmək"dən *f.is.*

**PÜFKÜRMƏK** b a x **püfləmək**. *Papiros tüstüsünü püfkürərək ağzından; O dalıb fikrə, baxır qurğuya heyran-heyran.* S.Rüstəm.

**PÜFLƏMƏ** "Püfləmək"dən *f.is.*

**PÜFLƏMƏK** *f.* Ağıza doldurulmuş havanı birdən buraxmaq, püf etmək; püfürmək. [Əhməd] *arxalığının cibindən tənbəki kisəsini çıxartdı, çubuğunu əvvəl püfləyib sonra doldurdu.* Çəmənzəminli. *Lətifədən səs çıxmadığını görən katibə trubkanı püfləməyə başladı.* M.Hüseyn.

◊ **Püfləyə-püfləyə saxlamaq** – bir şeyi çox ehtiyatla qoruyub saxlamaq. **Suyu püfləyə-püfləyə içmək** – çox ehtiyatlı hərəkət etmək.

**PÜFÜRMƏ** "Püfürmək"dən *f.is.*

**PÜFÜRMƏK** b a x **püfləmək**. *Şamama suyu ağzına alıb Hafizənin üstünə püfürür.* Ə.Haqverdiyev.

**PÜXTƏ** *sif.* [*fars.*] Təcrübəsi olan; bişkin, bişmiş, yetkin, təcrübəli. *Təcrübəli və püxtə yazıçı.* □ **Püxtə olmaq** – usta olmaq, yetkin olmaq, təcrübəli olmaq. [Qəmər:] *Sən hələ xamsan, püxtə olmağa çox səfər gərək.* S.S.Axundov. *Sərhəng, işin içindən çıxmaq üçün yalana müraciət etdi və belə işlərdə püxtə olduğuna görə səsinə inam və qüdrət verdi..* M.İbrahimov.

**PÜXTƏLƏNMƏ** "Püxtələnmək"dən *f.is.*

**PÜXTƏLƏNMƏK** b a x **püxtələşmək**.

**PÜXTƏLƏŞMƏ** "Püxtələşmək"dən *f.is.*

**PÜXTƏLƏŞMƏK** *f.* Bir işdə təcrübə qazanmaq, təcrübələnmək, ustalaşmaq, bərkdən-boşdan çıxmaq, püxtələnmək, yetkinləşmək, bərkimək. *Bütün ölkəni sel kimi bürüyən partizan dəstələri də bu dağlarda püxtələşmişdi.* S.Vəliyev.

**PÜXTƏLİK** *is.* Təcrübəlilik, bişkinlik, yetkinlik; *bir işdə püxtə olma. Yaradıcılıq bitkinlik və püxtəlik tələb edir.* S.Rəhimov.

**PÜNHAN** *sif.* və *zərf* [*fars.*] Heç kəsin bilmədiyi; gizli, xəlvət. *Nə sözüm, söhbətim, nə həmdəmim var; Dərdim ürəyimdə pünhan, ağlaram.* S.Vurğun. □ **Pünhan olmaq** – 1) gizli olmaq, xəlvət olmaq, başqasına bildirilməmək, gizlədilmək. [Kəndli Balasultana:] *Sultan ağa, səndən savayı bizim sahibimiz yoxdur və heç bir sirrimiz yoxdur ki, səndən pünhan olsun.* C.Məmmədquluzadə; 2) gizlənmək. *Naçar qalıb susdu daim ol zaman; Buludların altında oldu pünhan.* A.Səhhət.

**PÜNHANİ** *sif.* və *zərf* [*fars.*] Gizli(cə), xəlvəti. [C.Cabbarlı] *tamaşa zamanı isə qaranlıq, pünhani bir küncdə ayaq üstdə dayanır, səhnəni və tamaşaçıları öz dərin müşahidələrindən keçirirdi.* S.Rəhimov.

**PÜRE** [*fr.*] Əzilmiş göyərtidən, tərəvəzdən və meyvədən bişirilən xörək və ya xörək üstünə tökülən sous. *Kartof püresi. Pomidor püresi. Alma püresi hazırlamaq.*

**PÜRFƏND** *sif.* və *zərf* [*fars.* pür və *ər.* fənn] *klas.* Fəndgir, usta, mahir. □ **Pürfənd olmaq** *klas.* – usta olmaq, ustalaşmaq, mahirləşmək, bicləşmək.

**PÜRHƏVƏS** *sif.* [*fars.* pür və *ər.* həvəs] *klas.* Çox həvəsi olan; həvəsli. *Pürhəvəs, şerə mübtəla bir qız; Nurə aşiq, sevimli bir yıldız.* H.Cavid.

**PÜRİBARƏ** *sif.* [*fars.* pür və *ər.* ibarə] *kit.* Təmtəraqlı, obrazlı, ibarələrlə dolu (söz, nitq haqqında).

**PÜRKAMAL** *sif.* [*fars.* pür və *ər.* kamal] *klas.* Kamallı, ağıllı.

**PÜRQİYMƏT** [*fars.* pür və *ər.* qiymət] *klas.* Qiymətli. *Tacir də bir xeyli pürqiymət parçanı bir xonçaya qoyub, padşahın hüzuruna aparır.* (Nağıl).

**PÜRMƏLAL** *sif.* [*fars.* pür və *ər.* məlal] *klas.* Məlallı, məlalla dolu, çox kədərli. ☐ **Pürməlal eləmək (etmək)** *klas.* – çox kədərləndirmək, məyus etmək.

**PÜRMƏNA** *sif.* [*fars.* pür və *ər.* məna] *klas.* Mənalı, çox mənalı, məna ilə dolu; dərin. [Cənnətəli:] *Təbim mövzundur, yazılarım da pürməna.* Çəmənzəminli. *Yolda* [Səməd] *Əhmədi haradan tanıdığını sordu və Məşədi Məmməd pürməna təbəssümlə söylədi.* B.Talıblı.

**PÜRRƏNG** *sif.* [*fars.*] Yaxşı dəm almış; tünd (çay haqqında). *Xan xadiməyə qışqırdı: – Mirzənin çayını pürrəng edin!* S.Rəhimov. *Həsrət* [Yusif] *üçün papiros bükdü, bir stəkan pürrəng çay da gətirtdi.* B.Bayramov.

**PÜRVÜQAR** [*fars.* pür və *ər.* vüqar] *klas.* Vüqarla dolu; vüqarlı.

**PÜSKÜRMƏ** "Püskürmək"dən *f.is.*

**PÜSKÜRMƏK** *f.* 1. Öz içərisindən şiddətlə bir şey sovurub atmaq. *Vulkan püskürür. Pilpilə püskürür.*

2. *məc.* Saçmaq, buraxmaq. [Knyaz:] *Kin püskürən azğınlara yalnız; Dəhşətli ölüm vardır amansız!..* H.Cavid. *Kürəyə od püskürən krana yaxınlaşmaq çətin idi.* Mir Cəlal.

**PÜSKÜRTMƏ** "Püskürtmək"dən *f.is.*

**PÜSKÜRTMƏK** *icb.* Geri oturtmaq, geri atmaq, geriyə çəkilməyə məcbur etmək. *Düşməni mövqelərindən püskürtmək.*

**PÜSKÜRTÜ** *is.* Püskürmə işi; püskürmə. *Vulkan püskürtüsü.* // Püskürmə halında olan vulkanın ağzından çıxan kütlə; lava.

**PÜSTƏ** *is.* [*fars.*] 1. *bot.* Qışda yarpağı tökülən, quraqlığa davamlı, qabıqlı meyvə gətirən subtropik ağac. *Bağçanın ortasında tək bir püstə ağacı vardı.* M.Hüseyn. *Ovalıqların bəzi yerlərində kiçik püstə meşəlikləri tərkib etibarilə olduqca müxtəlifdir.* M.Qaşqay.

2. Həmin ağacın bərk və şəffaf qabıqlı ləpəsi olan yaşılımtıl meyvəsi. *Püstə ləpəsi.* – *Üst qabıqdan ayrılan şirmayı kimi zərif ağ qabıqlı püstələr yerə düşüb diyirləndi.* M.Rzaquluzadə. // *məc.* Adətən şeirdə gözəlin ağzı, dodaqları püstəyə oxşadılır. *Ey yanağı lalə, ləbləri püstə; Ağzı nabat, şəkkərzəban, bəri bax!* M.P.Vaqif. *Mən demədim sənə:* "*Ay ağzı püstə! Havadır oylağın, yerdir vətənin*". S.Vurğun.

**PÜSTƏQARIN** *sif.* Azyeyən, azacıq yeməklə doyan. *Püstəqarın adam.*

**PÜSTƏLİK** *is.* Püstə ağacları əkilmiş yer. *Püstəliyi becərmək.*

**PÜSTƏYİ** *sif.* Püstə rəngdə olan; açıqyaşıl. *Püstəyi parça.* – [Kəblə Heybətin] *ayağında püstəyi rəngdə sarı başmaq var idi.* H.Sarabski. [Əsəd] .. *püstəyi rəngli köynək geyib qırmızı zolaqlı qalstuk bağlamışdı.* Ə.Sadıq.

**PÜŞK** *is.* Bir mübahisəni həll etmək, yaxud bir şeyə haqqı olduğunu və ya bir şeyin üsul və qaydasını müəyyən etmək üçün eyni cür nişanlar arasından bəxtəbəxt götürülən şərti nişan, şey. *Püşk atdılar, püşk düşdü kiçik qardaşa.* (Nağıl).

**PÜŞTƏ** *is.* [*fars.*] *köhn.* Kiçik təpəcik; torpaq və ya qum topası, yığımı.

**PÜŞTİ** *is.* [*fars.*] *köhn.* Oturub söykənmək üçün divara dayadılan döşək. [Səkinə xanım:] *Gülsəba, yerə bir döşək sal, dalısına bir püşti qoy.* M.F.Axundzadə. *Tut ağacının altında zərif Kaşan xalçaları salınmış, məxmər döşəkçələr, ipək püştilər, mütəkkələr düzülmüşdü.* Çəmənzəminli.

**PYEDESTAL** [*fr.*] Üzərinə heykəl, sütun və s. dikəldilən bədii tərtibatlı özül; altlıq, postament. *Qranit pyedestalın üzərində böyük şairin 5 metr hündürlüyündə tunc fiqurası qoyulmuşdur.*

**PYES** [*fr.*] 1. Səhnədə göstərilmək üçün yazılmış dram əsəri. *M.F.Axundzadənin pyesləri. Pyesi tamaşaya qoymaq. – 1922-ci ildən başlayaraq* "*Aydın*" *və* "*Oqtay Eloğlu*" *pyesləri Azərbaycan səhnəsində tamaşaya qoyulur.* M.Arif.

2. Kiçik musiqi əsəri. *Musiqidə pyes adətən kiçik formalı instrumental musiqi əsərlərinə deyilir.* Ə.Bədəlbəyli.

# Rr

**R** Azərbaycan əlifbasının iyirmi dördüncü hərfi. b a x **er**.

**RABİTƏ** *is.* [*ər.*] 1. Bağlılıq, münasibət. *Nəzəriyyə ilə təcrübə arasında rabitə. İşi ilə sözü arasında rabitə yoxdur. – Aldığım məktubla* "*sizi tanıyıram*" *sözü arasında sıxı bir rabitə vardı.* S.Hüseyn. // Əlaqə, münasibət, irtibat. *Rabitə xidməti. Canlı rabitə. Telefon rabitəsi.* – [Müəllim:] *Əlbəttə, həmişə kəndlə şəhərin arasında rabitə vacibdir.* Ə.Haqverdiyev.

2. Texniki vasitələrin köməyi ilə müəyyən məsafədə əlaqə saxlayan idarələr sistemi (poçt, teleqraf, telefon, radio). *Rabitə işləri. Rabitə şöbəsi. Rabitə işçiləri.* // Hərbi hissələr arasında müxtəlif vasitələrlə həyata keçirilən əlaqə xidməti; irtibat. *Rabitə rotası. – Rabitə batalyonu və 3-cü briqadanın qərargahının komendant hissəsi isə şəhərin müsəlmanlar yaşayan şimal-qərb səmtində yerləşdirilmişdi.* İ.Şıxlı.

**RABİTƏÇİ** 1. *is.* Rabitə (2-ci mənada) işçisi. *Rabitəçilərin yarışı.* // Orduda: rabitə hissəsində xidmət edən şəxs. *Rabitəçilərin təlimi. Rabitəçilərin igidliyi.*

2. *Sif. mənasında.* Orduda: başqa hərbi hissələrlə və ya adamlarla əlaqə yaradan, həmin əlaqəni həyata keçirən. *Rabitəçi təyyarə. Rabitəçi əsgər.* – [Kəyan] *rabitəçisini* (is.) *Qulamın dalınca göndərmişdi.* Ə.Əbülhəsən.

**RABİTƏLƏNDİRMƏ** "Rabitələndirmək"dən *f.is.*

**RABİTƏLƏNDİRMƏK** *f.* Əlaqə yaratmaq, rabitə düzəltmək; əlaqələndirmək, bir-birinə bağlamaq. *Müəllim sualların cavabı üzərində şagirdləri işlədir və ayrı-ayrı cavabları bir-birilə rabitələndirib yığcam və ardıcıl bir yazı mətni düzəldib.* (Qəzetlərdən).

**RABİTƏLİ** *sif.* və *zərf* Yaxşı ifadə edilən, məntiqi və qrammatik cəhətdən düzgün qurulmuş; tərtibli, müntəzəm. *Rabitəli danışıq. Rabitəli danışmaq.*

**RABİTƏLİLİK** *is.* Məntiq və qrammatik cəhətdən müntəzəmlik, düzgünlük, tərtiblilik.

**RABİTƏSİZ** *sif.* Bir-biri ilə rabitəsi, əlaqəsi, münasibəti olmayan. [Nuriyyə:] *Biz qırıq-qırıq, rabitəsiz sözlər danışa-danışa şəhərdən çıxmışdıq.* İ.Əfəndiyev.

**RABİTƏSİZLİK** *is.* Rabitənin, əlaqənin, münasibətin olmadığı hal; əlaqəsizlik.

**RACA** *is.* [*sanskr.*] Qədim Hindistanda rəhbərlik və hakimlik rütbəsi.

**RAD** *is.* [*ing.*] Udulan şüalanma dozasının sistemdənkənar vahidi.

**RÁDA** [*ukr.*] Ukraynada ali qanunvericilik orqanı.

**RADÁR** [*ing.*] b a x **radiolokator**. *Radiolokasiyada işlədilən qurğulara radiolokator deyilir. Bəzi yerlərdə bunları müxtəsər olaraq radar adlandırırlar.* "Radiolokasiya".

**RAD[D]Ə** *is.* [*ər.*] Vaxt bildirən rəqəmlərdən sonra gələrək həmin rəqəmin təxmini olduğunu göstərir (adətən "radələri" və "radələrində" şəklində işlədilir). *Saat beş radələri idi. – Axşam saat on radələrindən xoruz səslənənədək içəridən həvəngdəstənin səsi gəldi.* Ə.Haqverdiyev. *Saat iki radələrində Mehman yan otağa keçib soyundu.* S.Rəhimov.

**RADİÁL** [*lat.*] Radius istiqamətində yerləşən. *Radial simmetriya.*

**RADİÁSİYA** [*lat.*] 1. Hər hansı bir cismin elektromaqnit dalğaları şüalandırması; cismin buraxdığı elektromaqnit şüa enerjisi. *Günəş radiasiyası.*

2. Bir şeyin mərkəzdən ətrafa şüa şəklində yayılması.

**RADİÁTOR** [*lat.* radiare – şüa buraxmaq] 1. Motorda suyu soyudan cihaz. *Təyyarənin radiatoru. Avtomaşının radiatoru.*

2. İçərisində isti su və ya buxar hərəkət edən borular sistemindən ibarət qızdırıcı cihaz. *Su radiatoru. Buxar radiatoru.*

**RADİKAL**[1] [*lat.* radicalis – kök] 1. *riyaz.* Kökalma əməliyyatını, eləcə də kökalmanın nəticəsini göstərən işarə ( $\sqrt{\ }$ ).

2. *kim.* Bir kimyəvi birləşmədən başqa kimyəvi birləşməyə dəyişməz keçən molekulda sabit atomlar qrupu.

**RADİKAL**[2] [*lat.*] 1. Radikallar partiyasının (sol siyasi partiyalardan birinin) üzvü, yaxud onun tərəfdarı olan şəxs (bu partiya-

ların proqramında dövlət çərçivəsində və onun mənafeyinə uyğun olaraq demokratik islahat irəli sürülür).

2. İfrat siyasi görüşlər, qəti hərəkət və tədbirlər tərəfdarı.

**RADİKAL³** *sif.* [*lat.*] Köklü, əsaslı, qəti, çox təsirli. *Radikal tədbirlər. Radikal dəyişikliklər.*

**RADİKALİZM** [*lat.*] 1. Dövlətin mənafeyi çərçivəsində demokratik islahat həyata keçirməyi tələb edən siyasi cərəyan; radikalların (b a x **radikal²** 1-ci mənada) dünyagörüşü, onların həyata keçirdikləri siyasət.

2. Nəzəri və təcrübi məsələlərin (xüsusən siyasi məsələlərin) həllində əsaslı qəti üsulların tətbiqi və bu üsulların müdafiə edilməsi.

**RADİKULÍT** [*lat.* radicula – rişə] *tib.* Haram iliyi (onurğa beyni) kökcüklərinin iltihabı.

**RÁDİO** [*lat.* radio – şüalandırıram] 1. Elektrik enerjisinin rabitə, radioverilişi, televiziya, radioteleqrafiya, radiolokasiya və s. məqsədlə məftilsiz olaraq elektromaqnit dalğaları şəklində uzaq və yaxın məsafələrə verilməsi və qəbulu.

2. Bu dalğalar vasitəsilə verilən siqnallar, səslər, radio və televiziya verilişi proqramları və s. *Radioya qulaq asmaq.*

3. Radioqram. *Moskvadan indicə radio alınmışdır. Paroxoddan hava haqqında radio alındı.*

4. *dan.* Radiostudiya. *Radioda işləmək.*

5. *dan.* Radioqəbuledici, reproduktor. *Yeni markalı radio.*

**radio...** [*lat.* radiare – şüalanmaq, şüa buraxmaq, radius – şüa] Mürəkkəb sözlərin birinci hissəsi olub aşağıdakı mənalarda işlənir: 1) radioya aid olan, radio ilə bağlı olan; məs.: radioklub, radioteleqram; 2) radiuma, radioaktivliyə, radiasiyaya aid olan; məs.: radioelement, radioizotoplar və s.

**RADİOAKTİV** *sif.* [*lat.* radiare – şüalanmaq və activus – fəal] Radioaktivliyə aid olan, radioaktivlik xassəsinə malik olan. *Radioaktiv maddələr. Radioaktiv izotoplar.*

**RADİOAKTİVLİK** *is.* Atom nüvələrinin nüvə hissəcikləri və ya qamma-kvantlar buraxaraq özbaşına və ya süni surətdə parçalanması (bu proses nəticəsində ilkin nüvələrdən fərqli olan yeni atom nüvələri əmələ gəlir). *Uranın radioaktivliyi.*

**RADİOBİOLÓGİYA** [*lat.* radiare, *yun.* bios və logos] Radioaktiv şüalanmanın orqanizmə təsirini öyrənən elm sahəsi.

**RADİOELEKTRÓNİKA** [*lat.* radiare və elektron] Elmin, radiotexnika və elektrotexnika əsasında inkişaf etmiş müxtəlif sahələrinin kompleksinin adı.

**RADİOKİMYA** [*lat.* radiare və *ər.* əlkimya] Kimyanın, radioaktiv maddələrin fiziki-kimyəvi və kimyəvi xassələrini öyrənən sahəsi.

**RADİOQƏBULEDİCİ** *is.* Radiodalğaların enerjisini tutmaq, onu başqa şəklə salmaq və istifadə etmək üçün aparat, cihaz.

**RADİOQRAM** [*lat.* radiare və gramma] Radioteleqraf vasitəsilə verilən məlumat.

**RADİÓLA** [*lat.* radiare] Qrammofon vallarını çaldırmaq üçün qurğusu olan radio cihazı. *Radiolanı işə salmaq. Yeni markalı radiola.*

**RADİOLAŞDIRILMA** "Radiolaşdırılmaq"dan *f.is.*

**RADİOLAŞDIRILMAQ** "Radiolaşdırmaq"dan *məch.*

**RADİOLAŞDIRMA** "Radiolaşdırmaq"dan *f.is.*

**RADİOLAŞDIRMAQ** *f.* Radioverilişi vasitələri, radio şəbəkələri, radioqəbuledicilər ilə təchiz etmək.

**RADİOLAŞMA** "Radiolaşmaq"dan *f.is.*

**RADİOLAŞMAQ** *f.* Radioverilişi ilə təchiz olunmaq.

**RADİOLÓGİYA** [*lat.* radiare və *yun.* logos] Radium və b. radioaktiv maddələrin təsiri və tətbiqi haqqında elm.

**RADİOLOKASİYA** [*lat.* radiare və locatio] Havada, su və yer üzərində olan obyektləri tapmaq və onların yerini həmin obyektlərin buraxdığı şüaların istiqamətinə görə müəyyənləşdirmək üsulu.

**RADİOLOKÁTOR** [*lat.*] Fəzada obyektlərin əks etdirdikləri radiodalğalar vasitəsilə onları tapmaq və olduqları yeri müəyyənləşdirmək üçün cihaz və qurğular sistemi.

**RADİOLOQ** [*yun.*] 1. Radiologiya mütəxəssisi.

2. Radioaktiv izotoplarla müalicə üsullarından istifadə edən həkim.

**RADİOMAYÁK** [*lat.* radiare və *rus.* маяк] Siqnallar vasitəsilə gəmi və təyyarələrin olduqları yeri onlara bildirən xüsusi verici radiostansiyası.

**RADİOREPORTAJ** [*lat.* radiare və *fr.* reportage] İşin gedişi, vəziyyəti və s. haqqında hadisə yerindən (stadiondan, müəssisədən və s.-dən) radio ilə birbaşa veriliş.

**RADİOSTÁNSİYA** [*lat.* radiare və stantio] 1. Radiosiqnalları verən və qəbul edən müəssisə.

2. Radiodalğalarını şüalandırmaq, habelə qəbul etmək üçün istifadə edilən texniki qurğu və aparatlar. *Təyyarənin radiostansiyası. Səyyar radiostansiya.*

**RADİOSTUDİYA** [*lat.* radiare və *ital.* studio] Radioverilişləri aparmaq üçün xüsusi təchiz olunmuş bina, otaq, yer.

**RADİOTEXNİK** [*lat.* radiare və *yun.* technike] Radiotexnika mütəxəssisi.

**RADİOTÉXNİKA** [*lat.* radiare və *yun.* technike] Yüksəkgərginlikli elektromaqnit rəqslərindən və onların rabitə, veriliş, naviqasiya, astronomiya və s.-də əməli tətbiqindən bəhs edən elm.

**RADİOTELEFÓN** [*lat.* radiare, *yun.* tele və phone] Radio ilə telefon rabitəsi saxlamaq üçün qəbuledici və verici aparatların məcmusu.

**RADİOTELEQRÁF** [*lat.* radiare, *yun.* tele və grapho] 1. Radio ilə teleqraf rabitəsi saxlamaq üçün qəbuledici və verici aparatların məcmusu.

2. Belə verilişləri aparan idarə, stansiya.

**RADİOTELEQRAM** [*lat.* radiare, *yun.* tele və gramma] b a x **radioqram**.

**RADİOTRANSLYÁSİYA** [*lat.* radiare və translatio] Radio proqramlarının məftilli rabitə xətti vasitəsilə verilməsi.

**RADİOVERİCİ** *is. xüs.* Radio vasitəsilə rabitə, radiolokasiya və s. məqsədlə radiodalğaları vermək üçün qurğu, aparat.

**RADİOVERİLİŞİ** *is.* 1. Radio dalğaları vasitəsilə danışıq, musiqi, şəkil və s.-nin məsafələrə verilməsi. *Morze sistemi ilə radioverilişi. Radioverilişinin təkmilləşdirilməsi.*

2. Radio vasitəsilə xüsusi proqramla dinləyicilərə verilən musiqi, şəkil, danışıq və s.

**RADİOZÓND** [*lat.* radiare və *fr.* sonde] Müxtəlif yüksəkliklərdə havanın təzyiqini, temperaturunu və rütubətini ölçmək üçün kiçik hava şarı vasitəsilə atmosferə qaldırılan və nəticəni avtomatik surətdə radio ilə yerə verən meteoroloji cihaz.

**RADİST** [*lat.* radiare] Radiotexnika ilə məşğul olan şəxs, radioverilişləri mütəxəssisi. *Qonaqlığın ən şirin yerində radist, Xəlilovdan radioqram gətirdi.* M.Hüseyn.

**RÁDİUM** [*lat.* radiare] Gümüşü-ağ metal şəklində radioaktiv kimyəvi element.

**RÁDİUS** [*lat.* radius, hərfi mənası – təkər mili, şüa] 1. *riyaz.* Şarın çevrəsinin və ya səthinin hər hansı nöqtəsini mərkəzi ilə birləşdirən düz xətt. // Bu xəttin uzunluğu.

2. *məc.* Bir şeyin əhatə dairəsi, fəaliyyət sahəsi, yayılma dairəsi. *Mərminin uçuş radiusu.*

**RADON** [*lat.* rad(iare) və *yun.* ag(on)] *kim.* Radiumun parçalanması nəticəsində hasil olan radioaktiv kimyəvi element – qaz.

**RATİFİKASİYA** *is.* [*lat.*] Dövlətin ali hakimiyyət orqanının dövlət və ya hökumət nümayəndəsi tərəfindən bağlanmış beynəlxalq sənədləri (müqavilə, saziş) təsdiq etməsi.

**RAH** *is.* [*fars.*] *klas.* Yol. *Bu rahdan etmək olmaz ikrah; Xoş rahdurur sənə gedən rah.* Füzuli.

**RAHAT** *sif.* və *zərf* [*ər.*] 1. Əziyyətsiz, əziyyət verməyən, narahat etməyən. *Yarım saata qədər yenə rahat uçuruq*. M.İbrahimov. *Maşın təzə olduğundan çox rahat idi.* Ə.Vəliyev. ☐ **Rahat durmaq** – nadinclik etməmək, sakit durmaq, əl-qol açmamaq. *Azanda div çöldə qalan çocuqları boğazlar; Tanrı bilməz, rahat durmaz insanları yeyərmiş...* A.İldırım. **Rahat etmək** – b a x **rahatlamaq**. *Qərib üçün xacə yer salıb, otaqların birində onu rahat etdi*. "Aşıq Qərib". [Nurəddini] .. *gecə qulluqçu rahat edəndə anası yadına düşüb, təzədən ağlamağa başladı.* S.S.Axundov. **Rahat qoymamaq** – incitmək, əziyyət vermək, narahat etmək, dinc qoymamaq, sakit qoymamaq. *Ən gözəl bir nəğməni; Durub dinləyəndə mən; Yadıma düşürsən sən; Rahat qoymursan məni!*

Ə.Cavad. **Rahat olmaq** – b a x **rahatlanmaq**. [Yavər Mədinəyə:] *Hə, indi rahat oldunmu, mənim əzizim? – deyib soruşdu*. M.İbrahimov. *Cavad gülümsündü, Aslanı göstərərək dedi: – Aslana yaxşı baxsan, mənim də ürəyim rahat olar*. Ə.Vəliyev.

2. Qayğısız, dərdsiz, dərdsiz-qəmsiz; sakit, asudə. *Rahat yaşamaq. – Rahat nəfəs çəkə bilmir uyquda; San qatilin görür durmuş pusquda.* A.Səhhət. [Mirzağa] *yalnız evlənməklə öz həyatını müəyyən bir şəklə sala bilər, onun sayəsində asudə, rahat bir həyat sürə bilərdi*. S.Hüseyn.

3. Gen, gen-bol, narahat etməyən. *Rahat paltar*.

**rahat-rahat** *zərf* Rahatcasına, rahatlıqla, narahat olmadan, sakit-sakit. *Qalın paltolu adamlar rahat-rahat küçələrdən keçirdilər*. A.Şaiq. *Yerinə girən kimi dərin yuxuya getmiş Aşıq Calal rahat-rahat nəfəs alırdı*. Ə.Məmmədxanlı.

**RAHATCA(SINA)** *zərf* Rahat halda; narahat olmadan, rahat-rahat, xatircəmliklə. [Məcid] [Nadirin] *iztirabını görməyib, rahatca öz söhbətinə davam edirdi.* B.Talıblı. *Rahatca xeyli göyərçin vurmaq mümkün idi.* M.Rzaquluzadə.

**RAHATLAMA** “Rahatlamaq”dan *f.is.*

**RAHATLAMAQ** *f.* 1. Yerini düzəltmək, rahat etmək, istifadə üçün münasib şəklə salmaq. *Stulun yerini rahatlamaq*. – [Yusif] *gah sabunu köpüklədir, gah ülgücü əlinin tilinə çəkib itiləyir, .. güzgünün yerini rahatlayırdı*. B.Bayramov.

2. Rahat olmaq, istirahət etmək üçün hər cür şərait yaratmaq. *Kosaoğlu köksünü ötürüb mütəkkəyə dirsəkləndi, ayaqlarını uzadıb yerini rahatladı, sağ əlini qırxıq başında gəzdirdi.* İ.Şıxlı.

3. Yəhər və ya çulunu götürərək yem və s. vermək (heyvanlar haqqında). *Dalınca dolanan anası ilə danışa-danışa Şirməmməd öküzləri rahatladı, çullarını alıb, qabaqlarına yem tökdü*. E.Sultanov. *Əsgərlər atları rahatlayıb, qoz ağacının altında yerə sərildilər.* H.Nəzərli.

**RAHATLANDIRMA** “Rahatlandırmaq”dan *f.is.*

**RAHATLANDIRMAQ** b a x **rahatlamaq**.

**RAHATLANMA** “Rahatlanmaq”dan *f.is.*

**RAHATLANMAQ** *f.* 1. Rahatlıq tapmaq, rahat olmaq, istirahət etmək, rahat nəfəs almağa başlamaq, özünü rahat hiss etmək. *Sadıq dalbadal bir neçə stəkan tünd çay içib qızışdı, rahatlandı*. Mir Cəlal.

2. Oturaraq və ya uzanaraq dincəlmək, dincini almaq, yorğunluğunu almaq. *Söyüd ağacının kölgəsinə bir palaz döşədib orada rahatlandım.* S.Hüseyn. [Dəmirov] *çarpayı üzərində oturub rahatlandı və kəndə tərəf baxmağa başladı.* S.Rəhimov.

**RAHATLAŞDIRMA** “Rahatlaşdırmaq”dan *f.is.*

**RAHATLAŞDIRMAQ** b a x **rahatlandırmaq**. *Xəstəni rahatlaşdırmaq. Uşağı rahatlaşdırmaq*.

**RAHATLAŞMA** “Rahatlaşmaq”dan *f.is.*

**RAHATLAŞMAQ** *f.* Rahat olmaq, sakitləşmək, narahatlığı keçmək.

**RAHATLIQ** *is.* 1. Qayğı, üzüntü, həyəcan, şübhə və s. olmadığı hal; asudəlik, dinclik, qayğısızlıq. *Bu sözlərdən sonra Bəyim sanki öz qəlbində bir rahatlıq hiss etdi.* İ.Əfəndiyev. [Hacı Murad:] *Bu zalım uşaqlarının əlindən bir saat da rahatlığım yoxdur.* S.S.Axundov. □ **Rahatlığını pozmaq** – narahat etmək, rahat qoymamaq, dincliyini pozmaq. [Rza:] [Bayquş] *gələn gündən atamın da, anamın da rahatlığı pozulmuşdu.* M.İbrahimov. [Natiq:] *Məni bağışlayın, Fərrux əmi, rahatlığınızı pozdum.* B.Bayramov. **Rahatlıq verməmək** – daim narahat etmək, dinc qoymamaq, rahat buraxmamaq. [Pəri Gülnisəyə:] [Əbdül] *daha bizə rahatlıq vermir, gedir, hərdənbir bəhanə ilə yüyürüb gəlir.* C.Cabbarlı. *Məlun şübhə Məmmədbağıra rahatlıq vermirdi.* S.Hüseyn.

2. İstirahət, dinclik, dincəlmə. *Heç rahatlığı yoxdur*. – *Yazın istisində, qışın qarında; Rahatlıq bilmədən yürür bu karvan.* M.Müşfiq. □ **Rahatlıq etmək (eləmək)** *dan*. – dincəlmək, istirahət etmək, dincini almaq. *Gülnar xanım bir az rahatlıq eləyəndən sonra bu gəlməyinin səbəbini dedi.* (Nağıl).

3. **Rahatlıqla** şəklində *zərf* – dərdqəmsiz, firavan, rahat. *Hacı Sultan .. iki evindən aldığı kirələrin sayəsində rahatlıqla keçinirdi.* S.Hüseyn.

**RAHATSIZ** bax **narahat**. ☐ **Rahatsız etmək** – narahat etmək. *Bu acı düşüncələr* [Poladı] *rahatsız edirdi*. A.Şaiq.

**RAHATSIZLIQ** bax **narahatlıq**. [Nəbi:] *Vallah, mən nökər belə rahatsızlığa davam edə bilmərəm*. S.S.Axundov. *Daxilən bir intizar, bir rahatsızlıq duyan Firidun axşam sərinində şəhəri gəzməyi qərara aldı*. M.İbrahimov.

**RAHƏTÜLHÜLQUM** *is*. [*ər*.] Şəkər və nişastadan (bəzən də içinə badam, fındıq və s. qoyularaq) hazırlanan Şərq şirniyyatı.

**RAHƏVİ** *is. mus.* Orta əsrlərdə Yaxın Şərqdə geniş yayılmış 12 əsas muğamdan biri.

**RAHİB** *is*. [*ər*.] Monastırda yaşayıb rahibliyə girmə (saç kəsdirmə) mərasimindən keçərək monastır nizamnaməsinin tələblərinə uyğun olaraq tərki-dünya həyat keçirməyi əhd etmiş şəxs (kişi). *Katolik rahiblər*. // *dan*. Tənha tərki-dünya həyat keçirən adam (kişi) haqqında.

**RAHİBƏ** *is*. [*ər*.] Qadın rahib (bax **rahib**).

**RAHİBLİK** *is*. Rahibin yaşayış tərzi, rahib olma.

**RAHLAMA** "Rahlamaq"dan *f.is*.

**RAHLAMAQ** bax **rahatlamaq**. *Rövşən qabaqca atasını rahladı, sonra qulunların yerini sahmanlayıb, tövləni hazırlamağa başladı*. "Koroğlu".

**RAXİ́T** [*yun*. rhachis – bel sümüyü] Böyüməkdə olan orqanizmdə duzların çatışmaması nəticəsində sümüklərin qeyri-normal inkişafı, maddələr mübadiləsinin pozulması şəklində təzahür edən uşaq xəstəliyi.

**RAXİTİZM** [*yun*.] Raxit xəstəliyi əlamətlərinin məcmusu; raxit xüsusiyyətləri.

**RAXİTLİ** *sif. dan.* Raxit xəstəliyinə tutulmuş. *Raxitli uşaq*.

**RAKET** [*alm*.] 1. Atəşfəşanlıq, habelə işıq siqnalları vermək üçün işlədilən içi barıt tərkibli maddələrlə doldurulmuş gilizdən ibarət mərmi. *Siqnal raketi. İşıqlandırıcı raket*.

2. Reaktiv mühərrikli uçucu aparat. *Kosmik raket. Çoxpilləli raket*. // *hərb*. Çıxan qaz reaksiyasının gücü ilə hərəkətə gətirilən döyüş mərmisi. *Yandırıcı raket. Fuqas raketi*. – *Atomunla, raketinlə; Sən elə zənn eləmə ki, Hakimisən yerin, göyün*. B.Vahabzadə.

◊ **Aparıcı raket** – orbitə çıxana qədər Yer və ya Günəşin süni peykini aparan çoxpilləli raketin son pilləsi.

**RAKETÇİ** *is*. 1. Raketlə siqnal verən adam (bax **raket** 1-ci mənada).

2. Raketə xidmət edən əsgər (bax **raket** 2-ci mənada). *Raketçi bölməsi*.

**RAKETKA** [*rus*., əsli *fr*.] 1. Tennis oyununda: topu vurmaq üçün oval torlu kürəkcik. *Tennis raketkası*.

2. Stolüstü tennis oynamaq üçün dairəvi kiçik kürəkcik. *Stolüstü tennis raketkası*.

**RAKETQAYIRMA** *is*. Raket istehsalı, raket qayrılması. *Raketqayırma sənayesi*.

**RAKETODRÓM** [*alm*. raketa və *yun*. dromos] Raketləri təcrübədən keçirmək və buraxmaq üçün xüsusi yer, meydança.

**RAKURS** *is*. [*fr*.] Baxım nöqtəsi, bucağı.

**RAQA** *is*. [*sanskr*.] *mus*. Qədim Hind klassik musiqisi növlərindən biri.

**RÁLLİ** *is*. [*ing*.] Avtomobil idmanı üzrə 1000-2000 km məsafədə keçirilən yarışlar kompleksi.

**RAM** [*fars*.]: **ram etmək** – özünə tabe etmək, özünə alışdırmaq, baş əydirmək, özünə lazım olan şəkildə dəyişmək; əhliləşdirmək. *Kərəm bir neçə ildən sonra atı tutub öyrətdi, özünə ram elədi*. M.Hüseyn. **Ram olmaq** – tabe olmaq, baş əymək. *Görürəm, suların gizli qüdrəti; İnsanın əlində indi ram olur*. R.Rza. [Qaşqa day] *yavaş-yavaş adamlara ram olurdu*. İ.Əfəndiyev.

**RAMA** [*rus*.] *xüs*. Hər hansı bir maşının, qurğunun, mexanizmin aparıcı hissəsi. *Avtomobilin* (*vaqonun, velosipedin*) *raması*.

**RAMAZAN** *is*. [*ər*. rəməzan] Hicri qəməri ərəb təqviminin 9-cu ayı; orucluq ayı. [Cahan:] *Bu ramazan yox, gələn ramazan gəlib ötəndən sonra* [Əsgərin] *iyirmi səkkiz yaşı tamam olacaqdır*. Ü.Hacıbəyov.

**RAMPA** [*fr*.] Səhnəyə yönəldilmiş işıqlandırıcı cihazları tamaşaçıdan gizlədən, səhnə boyu uzanan yastı sipər.

**RANET** [*fr*.] Qiymətli alma növlərindən birinin adı.

**RANQ** *is*. [*fr*.] Fərqlənmə dərəcəsi; kateqoriya, rütbə.

**RAPİ́RA** [*fr*.] Dördüzlü uzun elastik tiyəsi olan itiuclu silah (indi ancaq təlim və qılınc-

oynatma idmanında işlədilir). *Rapira üzrə dünya çempionatının qalibləri*.

**RAPİRAÇI** *is. idm*. Rapira ilə çıxış edən idmançı.

**RÁPORT** [*fr.*] 1. Hərbi xidmətçinin öz böyüyünə verdiyi şifahi və ya yazılı məlumat, xəbər. *Hüseyn raport verib komandirinə; Yönəlir katiblə iclas yerinə*. M.Rahim. [Aslan] *..kiçik komandirlərin raportlarını dinləyir, yeni əmrlər verirdi*. S.Vəliyev.

2. Yuxarı, rəhbər təşkilatlara verilən yazılı və ya şifahi məlumat.

**RAPSÓDİYA** [*yun.* rhapsodia] 1. Qədim yunan səyyar xanəndələrinin (rapsodlarının) simli musiqi alətinin müşayiəti ilə ifa etdikləri epik nəğmələr.

2. Xalq mahnı və rəqsləri mövzusunda yazılmış instrumental və ya vokal instrumental əsər. *Müslüm Maqomayev* "*Azərbaycan çöllərində*" *və* "*Ceyran*" *rapsodiyalarını, bir sıra marşlar bəstələmişdir*.

**RASİON** [*lat.* rationis – ölçü] Müəyyən vaxt üçün yemək norması, müəyyən vaxt üçün yemək payı; cirə. *Əsgərin gündəlik rasionu*. // Heyvanlara veriləcək gündəlik yemin miqdarı və tərkibi; yem norması. *Normalara müvafiq olaraq heyvanın bütün ehtiyaclarını təmin edən yemlərin gündəlik yığımına yem payı* (*rasion*) *deyilir*. "Ümumi zootexniya".

**RASİONÁL** [*lat.*] Ağıl və məntiqə əsaslanan; ağıllı, məqsədəuyğun, məqsədəmüvafiq. *Xammaldan rasional surətdə istifadə. İşin rasional təşkili*.

**RASİONALİST** [*lat.*] 1. Rasionalizm tərəfdarı (b a x **rasionalizm** 1-ci mənada).

2. Həyatda ancaq məntiq və ağlın tələblərinə əsaslanan adam.

**RASİONALÍZM** [*lat.*] 1. Ağlı idrakın yeganə mənşəyi hesab edən idealist fəlsəfi cərəyan.

2. Həyata şüurlu münasibət, hərəkətlərində şüurluluq.

**RAST**[1] [*fars.*] *sif.* Düz, müstəqim. ◻ **Rast gəlmək** – b a x **rastlaşmaq**. *Miraxur küçədə köhnə xəzinədara rast gəlib, ona yoldaş olub soruşdu ki..* M.F.Axundzadə. [Sultan:] *Bu gün bazardan keçərkən, Quluya rast gəlib, əhvalını sual etdim*. N.Nərimanov. *Nurəddin meşə ilə iki saata qədər yol gedəndən sonra bir çaya rast gəldi*. S.S.Axundov. **Rast gətirmək** – müvəffəq olmaq, düz gətirmək. [Xavər Kərimxana:] *..Sən nə bacarırdın, onu eləmisən. Allaha min şükür edirəm ki, məni sənə rast gətirdi. Mən başqa bir həyat istəmirəm!..* M.İbrahimov. **Rast olmaq** – b a x **rast gəlmək**. *Lütfəli qapıdan içəriyə girəndə Qurban ona rast oldu*. İ.Musabəyov. *Süfrə başında əyləşəndə dərviş dedi: – Sən ağılda adam heç mənə rast olmayıb*. (Nağıl). **Rastına gəlmək (çıxmaq)** – qabağına çıxmaq, rast gəlmək. [Dərviş:] *...Hər kəs rastıma gəlir, hamısını yavaş-yavaş dinə soyumuş görürəm*. C.Məmmədquluzadə. [Mərcan bəy:] *Bir göyçək arvaddır, rastıma çıxıbdır, alıram*. Ü.Hacıbəyov.

**RAST**[2] *is.* [*fars.*] *mus*. Azərbaycan klassik muğamlarından birinin adı. *Cavad gözlərini yumdu, cavanlar tarı və kamançanı götürüb* "*Rast*" *dəstgahını başladılar*. Ə.Haqverdiyev.

**RASTA** *is.* [*fars.*] *köhn.* Dükanların yerləşdiyi kiçik düz küçə; dükanlar sırası. *Buzu aldım əlimə və sərin baqqal rastasından çıxdım günün qabağına*. C.Məmmədquluzadə.

**RASTABAZAR** *is.* [*fars.*] *köhn.* Düz sıra ilə düzülmüş dükanlardan, mağazalardan və s.-dən ibarət bazar. *Rastabazarda şirin alış-veriş vardı, alıcının çoxu tərəkəmə idi*. Çəmənzəminli. [Ağaqurbanın] *Rastabazarda iki qapıdan ibarət böyük bəzzaz mağazası vardı*. Ə.Haqverdiyev.

**RASTLAŞMA** "Rastlaşmaq"dan *f.is. Ağasəfərlə rastlaşması heç də Nəcmiyə xoş gəlmədi*. Ə.Əbülhəsən.

**RASTLAŞMAQ** *f.* Təsadüf etmək, üz-üzə gəlmək, qarşısına çıxmaq, görmək. *Maşın üç at qoşulmuş bir araba ilə rastlaşdı*. H.Seyidbəyli.

**RATİFİKÁSİYA** *is.* [*lat.*] Dövlətin ali hakimiyyət orqanının dövlət və ya hökumət nümayəndəsi tərəfindən bağlanmış beynəlxalq sənədləri təsdiq etməsi.

**RATÍN** [*fr.*] Üz tərəfində burulmuş xovları olan üst paltarlıq yun parça. *5 metr ratin*. // Həmin parçadan tikilmiş. *Ratin pencək*.

**RATSİYA** *is.* Az güclü səyyar radiostansiya.

**RÁUND** [*ing.*] Boksda: vuruşun bir hissəsinin davam etdiyi iki və ya üç dəqiqəlik müddət.

**RAVİ** *is.* [*ər.*] *klas.* Rəvayət edən, hekayə edən, bir əhvalatı olduğu kimi danışan. *Ravi belə rəvayət eyləyir ki, bu zənən Bağdad padşahının baş hərəmi imiş.* (Nağıl).

**RAVVİN** *is.* [*qədimi yəh.* rabbi – mənim müəllimim] Yəhudilərin dini-əxlaqi həyatına başçılıq edən din xadimi, ruhani.

**RAY** [*ing.*] b a x **rels**.

**RAYİHƏ** *is.* [*ər.*] Xoş iy, gözəl qoxu; ətir. *Gülün rayihəsi. – Arazın mehi kənddən kövşənə xoş bir rayihə, gözəl bir qoxu gətirirdi.* Ə.Vəliyev. [Allahyar] *Mələyin sinəsindən və saçından gələn mixək iyinə bənzər rayihəni hələ də unuda bilmirdi.* İ.Şıxlı.

**RAYİHƏLİ** *sif.* Gözəl iyli, xoş qoxulu; ətirli. *Rayihəli çiçək. – Göz işlədikcə uzanan düzləri əlvan çiçəklər, rayihəli otlar cənnətə döndərmişdi.* M.Hüseyn.

**RAYKOM** *is.* "Rayon komitəsi"nin ixtisarı (çox vaxt "rayon partiya komitəsi" mənasında işlənir). *Raykom binası. Raykoma getmək.*

**RAYON** *is.* [*fr.*] 1. Bir ərazinin hər hansı bir coğrafi, iqtisadi və b. cəhətdən tam bir vəhdət təşkil edən hissəsi. *Sənaye rayonu. Kənd təsərrüfat rayonu. Ölkənin şimal rayonları. Tərəvəzçilik rayonu. – Bibiheybət Bakının qədim neft rayonlarından biri sayılırdı.* M.Hüseyn. // Yaşayış məntəqəsinin müəyyən xüsusiyyətləri ilə səciyyələnən hissəsi. *Fəhlə rayonu. Mərkəzi rayon.* // Bir hadisənin baş verdiyi və yayıldığı yer. *Hərbi əməliyyat rayonu. Daşqın rayonu.*

2. Vilayət, ölkə və respublikaların, eləcə də böyük şəhərlərin tərkibinə daxil olan inzibati-ərazi vahidi. *Şamaxı rayonu. Bakı şəhərinin Nəsimi rayonu. – Fərmanın uşaqlığı İsmayıllı rayonunun Zoğallı kəndində keçmişdir.* Ə.Sadıq. // Həmin dövlət ərazi vahidinin inzibati mərkəzi və orada yerləşən baş idarələr. *Rayondan göstəriş almaq*. – [Qulu:] *Hümmət söz verib ki, rayondan ekskavator da göndərsin.* İ.Əfəndiyev. [Yusif Hümmətə:] *İndi ki belə oldu, mən məsələni rayonda qoyacağam*. B.Bayramov.

**RAYONLARARASI** *sif.* Bir neçə rayon üçün ümumi olan, təşkil olunmuş; bir neçə rayona aid olan (xidmət edən). *Rayonlararası tikinti idarəsi. Rayonlararası mal-qara kökəltmə məntəqəsi.*

**RAYONLAŞDIRILMA** "Rayonlaşdırılmaq"dan *f.is.*

**RAYONLAŞDIRILMAQ** *məch.* 1. İnzibati, fiziki-coğrafi, iqtisadi və b. cəhətlərə görə rayonlara bölünmək.

2. *xüs.* Müəyyən fiziki-coğrafi rayonların şəraitinə ən çox uyğunlaşdırılmaq, aid edilmək. *Rayonlaşdırılmış* (f.sif.) *çiyid*.

**RAYONLAŞDIRMA** "Rayonlaşdırmaq"dan *f.is.*

**RAYONLAŞDIRMAQ** *f.* 1. Ərazini iqtisadi, inzibati və b. rayonlara bölmək.

2. *xüs.* Müəyyən rayona (və ya rayonlara) uyğunlaşdırmaq, aid etmək. *Buğda növünü rayonlaşdırmaq*.

**RAYSOVET** *is.* *tar.* "Rayon soveti"nin ixtisarı. *Raysovet sədri. Raysovetin qərarı*.

**RAZI** *sif.* və *zərf* [*ər.*] Bir şeydən razı olan; məmnun. *Yüz cəfa eyləsən, ey şux, könüldür razi.* S.Ə.Şirvani. *Qubernatordan tutmuş axırıncı pristavadək* [İskəndər bəyin] *evinə gələrkən hər barədə razı gedərdi.* Ə.Haqverdiyev. □ **Razı düşmək** – razılaşmaq, razılıq ifadə etmək, razı olmaq. *Vəzir nə qədər dedisə, padşah razı düşmədi.* (Nağıl). **Razı qalmaq** – razı olmaq, məmnun olmaq. [Rəhim xan Sitarəyə:] *Mən zənn edirəm ki, sən məndən razı qalarsan..* C.Cabbarlı. *Qoca .. gözlərini yarı qapayaraq şagirdinə qulaq asdı, onun könlü xoş bir iftixar hissi ilə isindi, ustad şagirdindən razı qaldı*. Ə.Məmmədxanlı. **Razı olmaq** – razılığını vermək, razılıq ifadə etmək. [Bayram:] *Sənin ölümünə heç vaxt razı ola bilmənəm*. M.F.Axundzadə. // Bir şeyə müsbət cavab vermək; icazə vermək, razılaşmaq. [Sərvər:] *Hərgah sən mən deyənə razı olsan, işi düzəldərəm*. Ü.Hacıbəyov. [Sevil Gülüşə:] *Yox, a qız, heç Balaş razı olar?* C.Cabbarlı. **Razı salmaq** – razı etmək, razılığını əldə etmək, məmnun etmək. [Alı kişi:] *Oğul, Rövşən, get, buzov yiyəsini tap, buzovun cəriməsini ver, razı sal.* "Koroğlu". [Gültəkin Dövlət bəyə:] *Mən heç bir şey istəmirəm. Yalnız* [Aydını] *razı salın*. C.Cabbarlı.

**RAZILAŞDIRILMA** "Razılaşdırılmaq"dan *f.is.*

**RAZILAŞDIRILMAQ** *məch.* Başqasının və ya başqalarının razılığı alınmaq. *Plan müəyyən idarələrlə razılaşdırılmışdır.*

**RAZILAŞDIRMA** "Razılaşdırmaq"dan *f.is.*

**RAZILAŞDIRMAQ** *f.* Bir şey haqqında başqası və ya başqaları ilə danışaraq onun (onların) razılığını almaq, ümumi bir fikrə gəlmək. *Layihəni lazımi təşkilatlarla razılaşdırmaq.*

**RAZILAŞMA** "Razılaşmaq"dan *f.is.*

**RAZILAŞMAQ** *f.* Razı olmaq, razılıq vermək, öz razılığını bildirmək, düzgün hesab etmək. *Başqasının fikri ilə razılaşmaq. – Kişi yenə də başını buladı və guya əlacsız qalıb razılaşdı.* H.Seyidbəyli.

**RAZILIQ** *is.* Razı olma, məmnunluq hissi; məmnuniyyət. *Ağrıdan, acıdan yaranır əsər; Ölər yaşanmamış söz bələyində; Bitməmiş, bitəmməz böyük bir əsər; Özündən razılıq kölgəliyində.* B.Vahabzadə. ☐ **Razılıq (razılığını) almaq** – razı olub-olmadığını öyrənmək, razılığını əldə etmək, razı olmasına nail olmaq. [Gülsabah:] [Qüdrət] *səni atıb gedirkən səndən razılıq aldımı?* C.Cabbarlı. *..Kamalın atası ova hazırlaşanda Kamal onunla getməyə razılığını aldı.* M.Rzaquluzadə. **Razılıq etmək** – razılığını bildirmək, təşəkkür etmək. *Nahar qurtarandan sonra Lütfəli razılıq edib öz evinə getdi.* İ.Musabəyov. *Fətulla hamının əlini sıxıb razılıq etdi.* Mir Cəlal. **Razılıq vermək** – razı olmaq, razı olduğunu bildirmək; icazə vermək. [Sərətan:] *Yox, gərək Afətə razılıq verəm; Yoxsa varlığımı parçalayar qəm.* M.Rahim.

**RAZYANA** *is.* [*fars.*] *bot.* 1. Efir yağı verən ot-bitki; həmin bitkinin şirin dadan və ədviyyə kimi işlədilən xoşiyli toxumu.

2. Turşaşirin dadan alma növü.

**RAZYANALIQ** *is.* Çoxlu razyana bitmiş sahə.

**REABİLİTÁSİYA** *is.* [*lat.*] 1. Təmizəçıxarılma.

2. Hüquqların bərpası.

3. Xəstəlik keçirmiş şəxslərin sağlamlığının və əmək fəaliyyətinin bərpası üçün tədbirlər kompleksi.

**REAGENT** [*lat.* re... – əks və agens – edən] Kimyəvi reaksiyada iştirak edən maddə; reaktiv.

**REÁKSİYA** [*lat.* re... – əks və actio – hərəkət] 1. Hər hansı bir təsirə cavab olaraq əmələ gələn təsir. // *fiziol. biol.* Orqanizmin xarici və ya daxili təxərrüşə münasibəti. *Orqanizmin soyuğa qarşı reaksiyası.*

2. Əhvalda baş verən kəskin dəyişiklik; gərginlikdən, yüksəlişdən, yaxşılıqdan sonra əmələ gələn düşkünlük, zəiflik.

3. *kim.* İki və ya bir neçə maddə arasında yeni maddələrin əmələ gəlməsinə səbəb olan qarşılıqlı təsir.

4. B a x **irtica**.

**REAKTİV[1]** [*lat.* re... – əks və activus – fəal] *kim.* Başqa maddə ilə birləşəndə xüsusi reaksiya əmələ gətirən və bununla da bu maddənin həmin tərkibdə olub-olmadığını aşkar etməyə imkan verən maddə.

**REAKTİV[2]** *sif.* [*lat.* re... – əks və activus – fəal] *fiz.* Qaz, buxar və s.-nin yaratdığı qüvvədən istifadə edən, həmin qüvvəyə əsaslanan. *Reaktiv mühərrik. Reaktiv hərəkat. Reaktiv təyyarə.*

**REÁKTOR** [*lat.*] Arasıkəsilməz və tənzim edilə bilən atom enerjisi almaq üçün qurğular sistemi (bu, atom nüvələrinin bölünməsinin zəncirvari reaksiyasından istifadə əsasında əmələ gəlir). *Atom reaktoru. Nüvə reaktoru.*

**REÁL** *sif.* [*lat.* realis] 1. Xəyalda deyil, həqiqətdə mövcud olan; həqiqi, gerçək. *Real həyat. Real varlıq. Real şey.* // Həyata keçirilə bilən, yerinə yetirilməsi mümkün olan. *Real plan.* // Əsil, həqiqi. *Real əsas.*

2. Həqiqi və obyektiv şəraitin, gerçək varlığın nəzərə alınmasına və izahına əsaslanan. *Real siyasət.*

◊ **Real əmək haqqı** – əmək haqqının alıcılıq qüvvəsi (real əmək haqqı verilən əmək haqqına nə qədər və nə kimi istehlak şeyi almaq mümkün olduğunu göstərir.

**REALİST** [*lat.*] 1. Real düşünən, öz işində, fəaliyyətində real varlığın şəraitini nəzərə alan və buna uyğun hərəkət edən adam. *Sən lap realistsən, ay Məhər kişi, – deyə sədr gülə-gülə ona müraciət etdi.* B.Bayramov.

2. Ədəbiyyat və incəsənətdə realizm tərəfdarı olan. *Realist rəssam. Realist yazıçı.*

3. Realizm tərəfdarı (b a x **realizm** 4-cü mənada).

4. 1917-ci il inqilabından əvvəlki Rusiyada: realni məktəb şagirdi. *Studentik, deyilik biz realist; Aramızdan çıkamaz idealist.* A.Səhhət.

**REALİZƏ** [*lat.*] Satma, satılma; satıb pula çevirmə, satılıb pula çevrilmə. *İstehsal olunan məhsulun realizəsi.* ☐ **Realizə edilmək** – satılıb pula çevrilmək. **Realizə etmək** – satıb pula çevirmək.

**REALÍZM** [*lat.* realis – maddi, həqiqi] 1. Həqiqi vəziyyəti, şəraiti, imkanları və qüvvələrin nisbətini dərketmə bacarığı.

2. Obyektiv varlığı və onun tipik xüsusiyyətlərini düzgün əks etdirməkdən ibarət bədii idrak üsulu, habelə ədəbiyyat və incəsənətdə həqiqi varlığı daha dolğun, daha düzgün, daha real əks etdirməyi bir məqsəd olaraq qarşısına qoymuş cərəyan. *M.F.Axundzadənin realizmi. Rəssamlıqda realizm. – N.Vəzirov və Ə.Haqverdiyevin əsərlərinin yaraşığı, hətta onların gücü, belə, həyata, varlığa sadiq olmalarında, ifadənin, bədii təsvirin həqiqiliyində, realizmindədir.* M.İbrahimov.

3. XIX əsr fəlsəfəsində idealizmə zidd cərəyanları göstərmək, müasir burjua fəlsəfəsində isə bir qayda olaraq bəzi cərəyan (məs.: neorealizm, tənqidi realizm və s.) tərəfdarlarının öz idealist mahiyyətlərini ört-basdır etmək üçün işlətdikləri termin.

4. Ümumi məfhumların əşyalardan qabaq və onlardan asılı olmayaraq mövcud olduğunu iddia edən orta əsr dini-idealist fəlsəfi cərəyanının adı.

◊ **Sosializm realizmi** *tar.* – sovet bədii ədəbiyyatı və incəsənətinin, dünya inqilabi ədəbiyyatının yaradıcılıq metodu. *Sosializm realizminin erkən sələfləri.* **Tənqidi realizm** – sənətin inkişafında müstəqil mərhələ təşkil edən, başlıca xüsusiyyəti gerçəkliyin dərin və düzgün əks etdirilməsi, kapitalizm quruluşu qüsurlarının və ziddiyyətlərinin ifşası, demokratik sosial idealların əsaslandırılmasından ibarət olan bədii cərəyan. *Tənqidi realizmin böyük ustaları.*

**REALLAŞDIRILMA** "Reallaşdırılmaq"dan *f.is.*

**REALLAŞDIRILMAQ** *məch.* Həyata keçirilmək. // Həyata keçirilmək üçün şərait yaradılmaq.

**REALLAŞDIRMA** "Reallaşdırmaq"dan *f.is.*

**REALLAŞDIRMAQ** *f.* Həyata keçirmək, gerçəkləşdirmək. // Həyata keçmək üçün şərait yaratmaq.

**REALLAŞMA** "Reallaşmaq"dan *f.is.*

**REALLAŞMAQ** *f.* Həyata keçmək, həyata keçirilmək, real bir şəkil almaq; gerçəkləşmək. // Həyata keçirilmək üçün şərait yaranmaq.

**REALLIQ** *is.* 1. Obyektiv mövcud olan varlıq; gerçəklik, həqiqilik.

2. Real olma, həqiqilik, həyatilik. *Siyasətin reallığı.*

**REÁLNİ** [*rus.,* əsli *lat.*]: **realni məktəb** – 1917-ci il inqilabından əvvəlki Rusiyada: tədris planında təbii və dəqiq elmlərə çox yer verilən, qədim dillər keçilməyən orta məktəb. *Qadir şəhərdən, oxuduğu realni məktəbdən qəsəbəyə tətilə gəldiyi vaxt bunu görürdü.* Ə.Əbülhəsən.

**REANİMÁSİYA** *is.* [*lat.*] Klinik ölüm vəziyyətində olan insanın canlanmasına yönəlmiş bədbəxt hadisə, xəstəlik nəticəsində həyat əlamətli orqanların qəflətən itirilmiş funksiyalarının bərpası üçün tədbirlər kompleksi.

**REBUS** *is.* [*lat.*] Fiqurlar, işarələr və rəsmlər vasitəsilə düzəldilən tapmaca.

**REÇİTATÍV** [*ital.* recitatio] *mus.* İntonasiya və ritm cəhətdən ifadəli nitqə yaxın olan vokal musiqi əsər forması; hava ilə deyilən deklamasiya.

**REDÁKSİYA** [*lat.* redaction – qaydaya, səliqəyə salma] 1. Mətni işləmə və düzəltmə, redaktə etmə. *Protokolun son redaksiyası. Əsərin redaksiyasını mütəxəssisə tapşırmaq.*

2. Hər bir nəşrin (kitabın, məcmuənin və s.-nin) nəşrinə rəhbərlik. *Professorun redaksiyası altında dərslik.* // Həmin işə rəhbərlik edən heyət, orqan. *Baş redaksiya. Redaksiya şurası. Redaksiya heyəti.*

3. Bir fikrin, tezisin, müddəanın bu və ya digər şəkildə ifadəsi, ifadə forması. *Nizamnamənin 3-cü paraqrafının yeni redaksiyası.*

4. Hər hansı bir bədii, musiqi və b. əsərin, yaxud onun ayrıca bir hissəsinin variantı. *Romanın yeni redaksiyası. "İldırımlı yollarla" baletinin yeni redaksiyası.*

5. Dövri mətbuat orqanının çapa hazırlanmasına rəhbərlik edən əməkdaşlar kollektivi. "*Ədəbiyyat və incəsənət*" *qəzetinin redaksiyası.* // Mətnin əlyazmasını işləyib çapa hazırlamaqla məşğul olan işçilər qrupu.

6. Redaksiya əməkdaşlarının işlədiyi bina. *Redaksiyanın ünvanı.*

**REDAKTƏ** *is.* [*lat.*] bax **redaksiya** 1-ci mənada. *Yaxşı bir şerimi redaktə vaxtı;* "*Hələ qalsın!*" *– deyə qoydu kənara.* X.Rza. ☐ **Redaktə etmək** – hər hansı bir mətni yoxlamaq və düzəltmək, sonuncu dəfə işləyərək çapa hazırlamaq. *Əlyazmasını redaktə etmək.*

**REDÁKTOR** [*lat.*] 1. Hər hansı bir işi (kitabı, qəzeti, jurnalı və s.) redaktə edən adam (bax **redaktə**). *Əsərin redaktoru. Texniki redaktor.*

2. Kitab, jurnal, qəzet və s.-nin nəşrinə rəhbərlik edən, onun məzmununu təsdiq edən şəxs. *Qəzetin redaktoru. Baş redaktor. Məsul redaktor. – Jurnalın təşəbbüskarı, təşkilatçısı və redaktoru C.Məmmədquluzadə* "*Molla Nəsrəddin*" *imzası ilə müntəzəm surətdə felyetonlar, baş məqalələr dərc edirdi.* M.İbrahimov.

**REDAKTORLUQ** *is.* Redaktorun fəaliyyəti, işi, vəzifəsi. *Sabirin* "*Nizədar*" *imzası ilə çap etdirdiyi satiralarının hamısı 1934-cü ildə yazıçı Seyid Hüseynin redaktorluğu ilə buraxılan* "*Bütün əsərlər*"*ə əlavə olunmuşdur.* M.Məmmədov.

**REDÚKSİYA** [*lat.* reducere – qaytarmaq, geri çəkmək] 1. *xüs*. Mürəkkəb haldan sadə hala keçmə, bir şeyin bu və ya başqa cəhətdən azalması, zəifləməsi.

2. *biol.* Bədən üzvünün öz funksiyasını itirməsi ilə əlaqədar olaraq ölməsi, həcmcə kiçilməsi, quruluşunun sadələşməsi. *Gözün reduksiyası.*

3. *kim.* Maddənin oksiddən təmizlənib bərpa olunması, oksiddən azad olması.

4. *tex.* Hər hansı bir kəmiyyətin azalması, kiçilməsi. *Buxar təzyiqinin reduksiyası.*

5. *dilç.* Müəyyən fonetik vəziyyətdə səsin zəifləməsi.

**REDÚKTOR** *is.* [*lat.*] Maşının təkərləri hərəkətə gətirən hissəsi.

**REDÚT** *is.* [*fr.*] Müdafiə üçün kvadrat, düzbucaqlı və ya çoxbucaqlı formasında düzəldilmiş qapalı səhra istehkam tikilisi.

**REFERÁT** [*lat.* referre – məruzə etmək, məlumat vermək] 1. Elmi əsərin, oxunmuş kitabın və s. şifahi və ya yazılı qısa məzmunu, xülasəsi. *Referat yazmaq*.

2. Ədəbi və başqa məxəzlərin icmalına həsr olunmuş hər hansı mövzuda məruzə.

**REFERATİV** *sif.* [*lat.*] Kitab, məqalə və s.-nin məzmununu qısa referat şəklində ifadə edən. *Referativ jurnal.*

**REFERÉNDUM** [*lat.* referendum – məlumat verilməli] Xüsusi əhəmiyyətli dövlət məsələlərinin həlli üçün ümumxalq sorğusu, ümumi rəy sorğusu. *Konstitusiya haqqında referendum*.

**REFERENSİYA** *is.* Firma və ya müəssisənin alım-ödəmə qabiliyyətinin şəhadətlik zəmanəti.

**REFERENT** [*lat.* referentis – məlumat verən] Bir idarədə, təşkilatda müəyyən məsələlər üzrə məlumat və məsləhət verən vəzifəli şəxs. *Referentlə məsləhətləşmək. Nazirliyin referenti.*

**REFLEKS** [*lat.* reflexus – inikas, əksetmə] 1. *fiziol*. Canlı orqanizmin qıcıqlanmaya, təsirə qarşı əsəb reaksiyası. *Heyvanlar aləmi anadangəlmə reflekslərə, instinktlərə malikdir.* M.Axundov.

2. *kit.* Bir hadisənin doğurduğu ikinci hadisə, onun nəticəsi, əksi; inikas, nəticə.

**REFLEKSİV, REFLEKTİV** *sif.* [*lat.*] Qeyri-şüuri, mexaniki, şüursuz, refleks nəticəsində olaraq (bax **refleks** 1-ci mənada). *Refleksiv* (*reflektiv*) *hərəkət.*

**REFLÉKTOR** [*lat.* reflektor – inikas etmək, əks etmək] 1. İşıq mənbəyindən çıxan şüaları əks etdirən. *Lampanın reflektoru.*

2. Əksetdiricisi olan elektrik lampalı qızdırıcı cihaz.

3. Əksetdirici batıq güzgüsü vasitəsilə əks alınan teleskop.

**REFLEKTÓR** *sif.* [*lat.*] *fiziol*. Qeyri-şüuri, mexaniki. *Reflektor hərəkət.*

**REFLEKTORLU** *sif.* Reflektoru olan, reflektorla təchiz edilmiş. *Reflektorlu teleskop.*

**REFORMÁSİYA** [*lat.*] *tar.* XVI əsrdə Qərbi Avropada: kəndlilərin və törəməkdə

olan burjuaziyanın feodalizmə qarşı mübarizəsi zəminində ortaya çıxaraq, sonradan katolik kilsəsinə qarşı dini mübarizə şəkli almış ictimai-siyasi hərəkat.

**REFORMİ́ST** [*lat.*] Reformizm tərəfdarı.

**REFORMİ́ZM** [*lat.* reformatio – dəyişmə, dəyişiklik] Fəhlə hərəkatında inqilabi sinfi mübarizənin, sosialist inqilabının və proletar diktaturasının zəruriliyini inkar edən və cüzi ictimai islahatlarla kifayətlənməyə, kapitalizmin əsaslarına toxunmamağa çalışan siyasi cərəyan. *Reformizmin sosial zəmini. Reformizm təftişçiliklə sıx bağlıdır.*

**REFRAKTOMÉTR** [*lat.* refractio – sınma və metreo – ölçürəm] Müxtəlif cisimlərdə işığın sınma göstəricilərini ölçmək üçün cihaz.

**REFRİJERÁTOR** [*fr.*] 1. Soyuducu maşının, mayenin buxarlandığı və aşağı temperaturun əmələ gəldiyi hissəsi; buxarlandırıcı.

2. Tez xarab olan məhsulları daşımaq üçün soyuducu maşınlarla təchiz olunmuş vaqon, gəmi, avtomobil və s. *Refrijerator vaqonu* (*gəmisi*).

**REGENT** [*lat.* regentis – idarə edən] Padşah əvəzinə ali hakimiyyəti həyata keçirən, dövləti müvəqqəti idarə edən şəxs.

**REGENTLİK** *is.* Padşahın xəstələnməsi, uzun müddət başqa yerdə olması, yaxud həddi-büluğa çatmaması və b. səbəblərə görə monarxiya ölkələrində dövləti bir və ya bir neçə şəxsin müvəqqəti idarə etməsi.

**REGİÓN** *is.* [*lat.*] Ərazi, ölkə, rayon.

**REGİ́STR** *is.* [*lat.*] Siyahı, göstərici.

**REJİM** [*fr.*] 1. Dövlət quruluşu, idarə üsulu. *Çar rejimi. Xalq demokratik rejimi.*

2. Yaşamaq, işləmək, istirahət etmək, yemək-içmək, yatmaq və s. üçün dəqiq müəyyən olunmuş qayda, üsul; nizam. *Gündəlik rejim. Düşərgənin rejimi. Yemək rejimi.*

3. Bu və ya digər məqsədlə müəyyən edilmiş qaydalar, tədbirlər sistemi. *Zavodda təhlükəsizlik rejimi.* // Bir şeyin iş, fəaliyyət və s. şəraiti. *Maşının iş rejimi. İstilik rejimi.*

**REJİSSÓR** [*fr.* regisseur, *lat.* rego – idarə edirəm] Teatr və ya kinematoqrafiya quruluşunun bədii rəhbəri; quruluşçu. *Tamaşanın rejissoru. Rejissorun göstərişi.*

**REJİSSORLUQ** *is.* 1. Rejissorun işi, sənəti, vəzifəsi.

2. Tamaşanın, filmin quruluşuna rəhbərlik; rejissura. [Əmrulla:] *Əsərin rejissorluğu Gülsabah xanıma tapşırılır*. C.Cabbarlı.

**REJİSSURA** [*fr.*] 1. Rejissorun fəaliyyəti, işi.

2. Tamaşanın, filmin quruluşuna rəhbərlik.

3. *top.* Tamaşa, film quruluşunun rəhbərləri; rejissorlar. [XIX əsrin ikinci yarısında] *Azərbaycan teatrının professional rejissurası yox idi.* C.Cəfərov.

**REKLÁM** [*lat.* reclamare – qışqırmaq] 1. Bir adama və ya bir şeyə şöhrət qazandırmaq, yaxud istehlakçı, müştəri, tamaşaçı cəlb etmək məqsədilə görülən tədbirlər. *Böyük dükanların vitrinləri, divarlar, hasarlar afişa, elan və reklamlarla dolu idi.* S.Rəhman. [Bəhlul:] [Nənəm] *ancaq parlaq reklam işıqlarını görə bilirdi*. B.Bayramov.

2. Məşhurlaşdırmaq, populyarlaşdırmaq məqsədilə bir adam və ya bir şey haqqında məlumat yayma.

3. Bir adam və ya şey haqqında məlumat verən, diqqəti cəlb edən elan, plakat.

**REKLAMÇI** *is.* Reklam tərtib edən, reklam düzəldən; reklam tərtibçisi.

**REKLAMÁSİYA** [*lat.* reclamatio – inkar, etiraz] *tic.* Malın keyfiyyəti aşağı olduğu üçün zərəri ödəmək haqqında tələb, iddia. *Parçanın pis rənginə görə reklamasiya*.

**REKÓN** *is.* [*lat.*] Genetik rekombinasiyanın elementar vahidi.

**REKORD** [*ing.*] 1. İdman yarışında göstərilən ən yüksək nailiyyət. *Dünya rekordu. Respublika rekordu.*

2. Əməyin, təsərrüfatın hər hansı bir sahəsində ən yüksək nailiyyət. *Çay yığımında rekord. – Gündə iki yüz on səkkiz kiloqram pambıq yığmaq o zaman çox böyük iş hesab olunur, rekord sayılırdı*. Ə.Sadıq.

**REKORDÇU** *is.* 1. B a x **rekordsmen**. *Rekordçu neft ustası. Rekordçu ekskavatorçu.*

2. Rekordlara, rekordizmə çox uyan adam.

3. Hər hansı bir xeyirli keyfiyyətinə görə rekord göstəricilərə malik ev heyvanı. *Rekordçu camış. Rekordçu inək.*

**REKORDÇULUQ** b a x **rekordizm**.

**REKORDİZM** [*ing.*] *idm.* Qeyri-sağlam rəqabət nəticəsində rekord qazanmağa göstərilən ifrat səy, rekorda uyma; rekordçuluq.

**REKORDSMEN** [*ing.*] 1. Rekord əldə etmiş idmançı; rekordçu.

2. *dan.* Əmək fəaliyyətində ən yüksək nailiyyətlər əldə etmiş adam.

**RÉKTOR** [*lat.* rector – rəhbər, idarə edən] Ali məktəbə, habelə ali və orta dini məktəbə rəhbərlik edən şəxs. *Universitet rektoru. Rektorun əmri.*

**REKTORAT** [*lat.*] bax **rektorluq** 2-ci mənada.

**REKTORLUQ** *is.* 1. Rektorun vəzifəsi, işi.

2. Ali məktəbin, rektorun başçılıq etdiyi inzibati tədris idarəsi; rektorat. // Həmin idarənin yerləşdiyi bina.

**REKVÍYEM** *is.* [*lat.*] Dini matəm mərasimində oxunan çoxsəsli silsilə xor əsəri.

**REKVİZÍT** [*lat.* requisitum – tələb olunan] Tamaşa və ya kinofilm çəkilən zaman lazım olan bütün əşyalar. ["Hamlet"də] *dekorlar, paltarlar, rekvizit, musiqi şərti bir Şərq üslubunda verilmişdi.* C.Cəfərov.

**REKVİZİTÇİ** bax **rekvizitor**.

**REKVİZİTOR** [*lat.*] Teatrda, kinostudiyada rekvizitə baxan adam; rekvizitçi.

**RÉQBİ** [*ing.* rugby] Uzunsov topla oynanılan futbol oyunu növlərindən biri.

**REQBİÇİ** *is.* Reqbi oynayan adam.

**REQLÁMENT** [*fr.*] Müşavirənin, iclasın, qurultayın və s. aparılması qaydası haqqında qabaqcadan müəyyən və qəbul edilmiş nizamnamə. *Reqlamentə riayət etmək. Reqlamenti pozmaq. Reqlamentdən kənara çıxmaq.*

**REQLAN** [*ing.*] Qolları çiyni ilə bütöv biçilmiş, habelə bu cür biçilmiş palto və s. *Reqlan palto. Reqlan paltar.*

**REQRÉSSİYA** *is.* [*lat.*] Dənizin tədricən geri çəkilməsi halı.

**RELAKSİYA** *is.* [*lat.*] 1. Zəifləmə.

2. Gərginliyin özbaşına azalması halı.

**RELÉ** [*fr.*] Elektrik dövrəsini müəyyən hadisələr zamanı avtomatik olaraq açan və ya bağlayan alət.

**RELÍKT** *is.* [*lat.* relictum – qalıq] Çox qədim dövrlərin qalığı olan şey, hadisə; qalıq. *Yalançı reliktlər.*

**RELS** [*ing.* rails, rail, *lat.* regula – düz taxta, tir] Üzərində vaqon, vaqonet və s. təkərlərinin diyirlənərək hərəkət etdiyi ensiz polad tir, ray. [Qəhrəmani] *vağzalın böyük binasından keçib relslərin üstündən adlayaraq depoya tərəf getdi.* M.İbrahimov. *Relslər uzandıqca, gödəlir yollar; Təpələr aşırıq, dağlar aşırıq.* S.Rüstəm.

**RELSLİ** *sif.* Relslərdən düzəldilmiş, yaxud rels üzərində hərəkət edən. *Relsli yol. Relsli nəqliyyat.*

**RELSSİZ** *sif.* Rels döşənməmiş, rels üzərində hərəkət etməyən. *Relssiz nəqliyyat.*

**RELYATİVÍST** [*lat.*] Relyativizm tərəfdarı.

**RELYATİVİZM** [*lat.* relativus – nisbi] *fəls.* İnsan idrakının nisbiliyi, şərtiliyi və subyektivliyi haqqında idealist cərəyan. *Relyativizm fiziki idealizmin qnoseoloji mənbələrindən biri olmuşdur.*

**RELYÉF** [*fr.* relief] Yer səthində olan müxtəlif kələ-kötürlük, dərə-təpə, dağ və düzənlik və s. *Dəniz dibinin relyefi. Rayonun relyefi.*

**REMÁRKA** [*fr.* remarque] Pyes müəllifinin, hadisənin hansı şəraitdə gedəcəyini, personajların davranışının və xarici görkəminin xüsusiyyətlərini səciyyələndirən izahı.

**REMÉDİUM** *is.* [*lat.*] Qızıl sikkə standartı şəraitində sikkənin faktik çəkiyə və əyara görə qanuni normadan kənara çıxması.

**RÉNTA** [*alm.* Rente, *fr.* rente] 1. *iqt.* Sahibinin fəaliyyəti tələb olunmadan kapital, əmlak və ya torpaqdan müntəzəm alınan gəlir. *Torpaq rentası.*

2. *mal.* İstiqraz vərəqəsi sahiblərinə daimi gəlir gətirən müddətsiz dövlət istiqrazı. *Dövlət rentası.*

**RENTGÉN** [alman fizikinin adından] 1. Rentgen şüaları ilə işıqlandırma. *Rentgenin nəticəsi.* ◻ **Rentgen şüaları** – qeyri-şəffaf cisimlərdən keçə bilən qısa elektromaqnit dalğalardan ibarət gözlə görünməyən şüalar.

2. Həmin şüalarla işıqlandıran cihaz. *Rentgen kabineti.*

**RENTGENOQRÁFİYA** [rentgen və *yun.* grapho – yazıram] Rentgen şüaları vasitəsilə qeyri-şəffaf cisimlərin daxili quruluşunun şəklinin çəkilməsi.

**RENTGENÓQRAM** [rentgen və *yun.* gramma – yazı] Rentgen şüaları vasitəsilə fotoplastinka və ya plyonkada alınan əks.

**RENTGENOLÓGİYA** [rentgen və *yun*. logos] Tibbin, rentgen şüalarının diaqnostika və müalicə məqsədilə tətbiqindən bəhs edən şöbəsi.

**RENTGENOLOJİ** *sif.* [rentgen və *yun*. logos] Rentgenologiya ilə əlaqədar olan, rentgenologiya ilə bağlı olan. *Rentgenoloji üsul.*

**RENTGENOLOQ** [rentgen və *yun*. logos] Rentgenologiya və rentgen şüaları ilə müalicə mütəxəssisi olan həkim.

**RENTGENOSKOPİK** *sif.* [rentgen və *yun*. skopeo – baxıram] Rentgenoskopiyaya aid olan, rentgenoskopiya ilə əlaqədar olan. *Rentgenoskopik üsul.*

**RENTGENOSKÓPİYA** [rentgen və *yun*. skopeo – baxıram] Qeyri-şəffaf cisimlərin rentgen şüaları vasitəsilə tədqiq edilməsi, yoxlanılması.

**RENTGENOTERAPÍYA** [rentgen və *yun*. therapeia] Rentgen şüalarının müalicə məqsədilə tətbiqi.

**REOSTÁT** [*yun.* rheos – axın və statos – hərəkətsiz] Elektrik çevrəsində enerjinin və gərginliyin gücünü nizama salan cihaz.

**REPERTUÁR** [*fr.*] Teatrda, estradada, konsertdə və s.-də ifa olunan dramaturji, musiqi və s. əsərlərinin məcmusu. *Teatrın repertuarı.* // Birisinin ifa etdiyi rolların, musiqi əsərlərinin və s.-nin məcmusu. *Artistin repertuarı. – Seyid Şuşinski həmişə dinləyicilər qarşısında zəngin və orijinal repertuarla çıxış etmişdir.*

**REPETİSİYA** [*lat.*] Tamaşanın, konsertin, kinoçəkilişi üçün səhnənin və s. hazırlanması üçün görülən ilkin işlər; habelə nümunə üçün onların ifası; məşq.

**RÉPLİKA** [*fr.*] 1. Natiqin çıxışı və ya tamaşa zamanı yerdən atılan söz, edilən etiraz. *Züleyxa sözünü bitirməmişdi ki, Aslan bir replika atdı.* C.Cabbarlı. *..Dilbər xanım səhnəyə çıxan kimi ətrafımda oturanlardan belə replikalar eşidirdim.* S.Rəhman.

2. *hüq*. Tərəflərdən birinin məhkəmə prosesində etirazı. *Replika vermək.*

3. *teatr*. Səhnədə bir rolda oynayan şəxsin tərəfi-müqabilin sözlərinə cavabı, habelə bir personajın axırıncı sözləri (ki, bunun ardınca o biri personajın sözləri gəlir).

4. Musiqi frazasının başqa səs və ya başqa tonda təkrarı.

**REPORTÁJ** [*fr.* reportage] Günün hadisələri haqqında dövri mətbuatda çap olunan və ya radio və televiziya ilə verilən məlumat. *İdman yarışı haqqında radio ilə reportaj.*

**REPORTYOR** [*ing.* əsli *fr.*] Yerli həyatda baş verən hadisələr, əhvalatlar və s. haqqında məlumat verən qəzet, jurnal, radio, televiziya, məlumat agentliyi və s. işçisi.

**REPORTYORLUQ** *is.* Reportyorun işi, fəaliyyəti.

**REPRESSİYA** *is.* [*lat.*] 1. Təqib etmə, kütləvi cəzalandırma.

2. Mənəvi təzyiq.

**REPRÉSSOR** *is.* [*lat.*] Tənzimləyici xüsusi zülal.

**REPRÍZA** *is.* [*fr.*] 1. Musiqi əsərinin hər hansı bir hissəsinin təkrarı.

2. Sirk və estradada klounun səslə, yaxud pantomima vasitəsilə ifa etdiyi məzhəkə, zarafat.

**REPRODÚKSİYA** [*lat.* re – yenidən və productio – düzəltmə] 1. Poliqrafik və ya fotoqrafik üsulla şəkil, rəsm, çertyoj, çap olunmuş mətnin surətinin çıxarılması və çoxaldılması.

2. Yenidən çap edilmiş şəkil, rəsm və s. *Rəssamın əsərinin repreduksiyası.*

**REPRODÚKTOR** [*lat.*] Radioverilişlərini ucadan səsləndirən cihaz, aparat; səsucaldan. *Eldar .. pəncələri üstündə yeriyərək reproduktorun səsini kəsmək üçün əlini uzatdı.* M.Rzaquluzadə.

**REPS** [*fr.*] Xırda qabarıq zolaqlı sıx parça. // Həmin parçadan tikilmiş.

**RESEPT** [*lat.* receptum – alınmış] Həkimin, qəbul edilmək qaydası da daxil olmaqla dərman hazırlamaq üçün aptekə yazılı göstərişi; nüsxə. *Professor resept yazdıqdan sonra Səriyyə ilə vidalaşdı və sabah yenə gəlib xəstəyə baxacağını vəd etdi.* M.Hüseyn. // Bir şeyi hazırlama üsulu, qaydası. // *məc. dan.* Bu və ya başqa təsadüfdə necə hərəkət etmək haqqında məsləhət, göstəriş.

**RESEPTAR** [*lat.*] Həkimin reseptinə əsasən dərman sifarişini qəbul edən aptek işçisi.

**RESEPTURA** [*lat.*] Dərman yazılması və hazırlanması qaydalarının məcmusu. // Bir

şeyi hazırlamaq haqqında məlumatların məcmusu. *Boyanın resepturası.*

**RESİDİV** [*lat.* recidivus – qayıdan] *hüq.* Cəzasını çəkdikdən sonra eyni və ya başqa cinayəti təkrar etmə; təkrar cinayət.

**RESİDİVİST** [*lat.*] Cinayət üstündə cəza çəkdikdən sonra təkrar cinayət etmiş adam.

**RESPİRÁTOR** *is.* [*lat.*] Tənəffüs üzvlərini havadakı zəhərli maddələrdən qoruyan fərdi cihaz.

**RESPÚBLİKA** [*lat.* respublica, res – iş və publicus – ictimai, ümumxalq] Ali hakimiyyət orqanları xalq tərəfindən müəyyən müddətə seçilən dövlət idarə forması; belə idarə üsulu olan ölkə. □ **Xalq demokratik respublikası** – siyasi əsasını xalq məclisləri və xalq Şuraları təşkil edən sosialist tipli dövlət idarə forması.

**RESPUBLİKAÇI** *is.* 1. Respublika idarə üsulu tərəfdarı.

2. Respublika partiyasının üzvü.

**RESPUBLİKALARARASI** *sif.* Bir neçə respublikaya aid olan, bir neçə respublikanın təşkil etdiyi. *Respublikalararası yarış.*

**RESSÓR** *is.* [*fr.*] Amortizasiyaedici quruluş.

**RESTORAN** [*fr.*] Yüksək tipli aşxana. *Bulvarda qaynaşan adamların gurultusu, bufet və restoranlarda çalınmaqda olan musiqilərin ruhnəvaz səsi eşidilirdi.* S.Hüseyn. "*İslamiyyə*" *restoranının qabağında böyük bir izdiham qaralır.* Mir Cəlal.

**RESTORANÇI** *is. köhn.* Restoran sahibi. [Tələbə:] *Gördüm restorançı bizə qoxumuş lobyanı yedirmək istəyir.* Qantəmir.

**RESÚRS** *is.* [*fr.*] Pul vəsaiti, sərvət; dövlət büdcəsində gəlir mənbəyi.

**RETRO** *is.* [*ing.*] 1. Geri qayıtmaq.

2. Keçmişə uyğunluq, keçmişi təkrar yönümlü üslub.

**RÉTUŞ** [*fr.*] Fotoqrafiyada şəkilləri çap etmədən əvvəl şüşə və s. üzərində düzəltmə işi, üsulu.

**RETUŞÇU** *is.* Retuş edən, retuşlama mütəxəssisi.

**RETUŞLAMA** "Retuşlamaq"dan *f.is.*

**RETUŞLAMAQ** *f.* Retuşla düzəltmək, retuş etmək.

**REVMATİK** [*yun.*] Revmatizm xəstəliyi olan adam.

**REVMATİZM** [*yun.*] *tib.* Əsasən oynaqlarda və əzələlərdə kəskin ağrılar şəklində təzahür edən, xalq arasında "yel" adlanan xəstəlik. *Xronik revmatizm.*

**REVYU** *is.* [*fr.*] Çeşidli musiqili sənət əsərlərinin xüsusiyyətlərini özündə birləşdirən teatr tamaşası.

**REYD**[1] [*holl.* reed] *dəniz.* Gəmilərin, limanın daxilində və ya yaxınlığında lövbərdə durduqları yer. *Reyddə durmaq. – Reyddə dayanan bütün gəmilər əlvan bayraqlarını qaldırmışdılar.* (Qəzetlərdən).

**REYD**[2] [*ing.* raid] 1. *hərb.* Mütəhərrik hərbi qüvvələrin hər hansı bir məqsədlə düşmən arxasına soxulması, basqını. *Süvari reydi. Partizanların müvəffəqiyyətli reydi.*

2. İctimai təşkilatların və ya mətbuatın tapşırığı ilə fəallar dəstəsinin gözlənilmədən apardığı təftiş, yoxlama. *Axşam qızlar evə qayıdanda reydi yaxşı keçirmək məsələsini bir də müzakirə elədilər.* Ə.Vəliyev.

**REYÉSTR** *is.* [*lat.*] Sənədləri və əmlakı qeydə alma kitabı.

**REYHAN** *is.* [*ər.*] *bot.* Xoşiyli, dekorativ, bəzi növləri yeyilən birillik mədəni bitki. *Ey atam hünərli, babam fikirli; Ey reyhan nəfəsli, yarpız ətirli; Nağıl nənələrin ey laylay səsi.* B.Vahabzadə.

**REYHANİ** *is.* [*ər.*] *mus.* Ağır-ağır oynanılan Azərbaycan oyun havalarından birinin adı.

**REYXSKÁNSLER** [*alm.* Reichskanzler] Almaniyada: 1945-ci ilə qədər dövlət kansleri, hökumət başçısı.

**REYXSTAQ** [*alm.* Reichstag] Almaniyada: 1933-cü ilə qədər seçilən (faşizm dövründə isə təyin olunan) alman parlamenti; habelə həmin parlamentin iclası keçirilən bina. *..Yandı reyxstaq; Quzğunlar yatağı, o qanlı yuva!* S.Vurğun.

**RÉYXSVER** [*alm.* Reichswehr] Birinci dünya müharibəsindən sonra 1935-ci ilə qədər alman hərbi qüvvələrinin adı.

**REYKA** [*rus.*] Suyun səviyyəsini, qar və ya buz örtüyünün və s.-nin hündürlüyünü ölçmək üçün üzərində bölgülər olan dar, nazik taxta və ya ağac. *Gülşənin göstərişilə manqa üzvləri pambıq kollarını yoxlayır, reyka ilə ölçür.* Ə.Vəliyev. // *geod.* Geode-

ziya işlərində: iki nöqtənin nisbi hündürlüyünü müəyyənləşdirmək üçün işlədilən bölgülü taxta, ağac. // *dan.* Ümumən bir qaydada kəsilib rəndələnmiş uzun və ya qısa nazik taxta.

**REYS** [*alm.* Reise – gəzinti, səyahət] Müəyyən xətdə (marşrutda) işləyən gəmi, təyyarə, maşın və s. hərəkətinin başlanğıcı ilə sonu arasındakı məsafə, yol. *Reysi başa vurmaq. İkinci reys. – Bir neçə reysdən sonra baş mühəndis Əlüddinə tapşırdı ki, gedib gözləsin.* H.Seyidbəyli.

**REYSFEDER** [*alm.* Reizfeder] Tuş və ya həll olunmuş rənglə xətt çəkmək üçün rəsmxət aləti.

**REYTUZ** *is.* [*alm.*] Dar şalvar; toxunma uzun darbalaq.

**REZİ́DENT** [*lat.* residens – oturan] 1. İmperialist dövlətlərin protektoratda (himayələri altında olan ölkədə) əslində oranın hakimi olan nümayəndəsi.

2. Səfirdən bir rütbə aşağı olan diplomatik nümayəndə.

3. Bir ölkənin daim başqa ölkədə yaşayan vətəndaşı.

4. Kəşfiyyat idarəsinin xarici dövlətin müəyyən rayonunda gizli nümayəndəsi.

**REZİ́N** [*lat.* resina – qatran] 1. Kauçukun vulkanizə edilməsi nəticəsində alınan su və hava keçirməyən elastik material.

2. B a x **rezinka**. [Gəldiyevin] *düz on yeddi gün qələm, xətkeş, pərgar, rezin əlindən düşmədi.* Mir Cəlal.

3. Həmin materialdan düzəldilmiş, hazırlanmış. *Altı rezin ayaqqabı. Rezin əlcək. – Bağban .. əlindəki rezin borunu bir az da yuxarı qaldırıb, Səmədi diqqətlə gözdən keçirdi.* M.Hüseyn. [Sultanovun] *ayağında uzunboğaz rezin çəkmə var idi.* Ə.Sadıq.

**REZİNKA** [*rus.*] Yazını pozmaq üçün rezin parçası; pozan, rezin.

**RƏBB** *is. ər.* Allah, Tanrı. [Sona] *sonra* "*ah rəbbim!*" *– deyə taxtın üstə yıxıldı.* N.Nərimanov. ☐ **Ya rəbb!** – Allaha müraciət: ay Allah! *İnsandan insana körpümüz sınıb; Ya rəbbim, hamımız sənə sığınıb.* B.Vahabzadə.

**RƏBİÜLAXİR** *is.* [*ər.*] Hicri qəməri ərəb təqviminin dördüncü ayı.

**RƏBİÜLƏVVƏL** *is.* [*ər.*] Hicri qəməri ərəb təqviminin üçüncü ayı.

**RƏBT** *is.* [*ər.*] 1. Bağlama, ilişdirmə. ☐ **Rəbt etmək** – bağlamaq, ilişdirmək, əlaqələndirmək. *İki sözü bir-birinə rəbt edə bilmir.*

2. Əlaqə, münasibət, aidiyyət. "*Şərqi-rus*" *qəzetinin söhbətini mən burada ondan ötrü açdım ki, bu söhbətlərin* "*Molla Nəsrəddin*" *tarixinə çox yavıq rəbti var.* C.Məmmədquluzadə.

**RƏCƏB** *is.* [*ər.*] Hicri qəməri ərəb təqviminin yeddinci ayı. *Getdi rəcəb, indi də şəban gəlir; Cisminə kor mollaların can gəlir.* Ə.Nəzmi.

**RƏCƏZ** *is.* [*ər.*] *klas.* 1. Əruz vəznində olan şeir formalarından birinin adı.

2. Döyüş və güləşmədən əvvəl pəhləvanların üz-üzə durub oxuduqları şeir. *Uluq bəy əlindəki qılıncını göydə oynadaraq rəcəz oxuyur.* A.Şaiq. *Bəylər pəhləvan kimi meydana girib, bir-birinə rəcəz oxudular.* Ə.Vəliyev.

**RƏD** *is.* [*ər.*] *köhn.* Göy gurultusu.

**RƏDD[1]** *is.* [*ər.*] Qəbul etməmə, yox cavabı vermə, mənfi cavab vermə. [Cavanşir:] *Sasani qoşunlarının sərkərdəsi Bəhrama rədd cavabı verilsin!* M.Hüseyn. *Kazım əli ilə rədd işarəsi verdi.* Mir Cəlal. ☐ **Rədd etmək** – 1) qəbul etməmək, yox cavabı vermək, mənfi cavab vermək, razı olmamaq. [Mirzağa] *qorxurdu ki, Cəmilə onun təklifini rədd edər.* S.Hüseyn. *Anam dayımın təklifini rədd etdi.* S.S.Axundov; 2) özündən uzaqlaşdırmaq, başından eləmək. *Gülpəri də* [Baharın] *ona Nurəddin barədə gizlin gözətçi olmasını duyub, Baharı bir yolla rədd etmək fikrində idi.* S.S.Axundov; 3) qovmaq, qəbul etməmək. [Balaş:] *Sevil! Diz üstə çöküb bir çocuq kimi yalvarıram; məni öldür, rədd etmə!* C.Cabbarlı. [Xalıqverdinin] *aləmində qonağı rədd eləmək nanəciblik idi.* Ə.Vəliyev. **Rədd ol!** – birisini özündən uzaqlaşdırmaq, qovmaq məqamında işlədilir. [Məşədi İbad:] *Əşi, rədd ol o yana, bir sən qalmışdın ki, məni soyasan.* Ü.Hacıbəyov.

**RƏDD[2]** *is.* [*ər.*] Ləpir, ayaq yeri, iz. *Sabah olan kimi hər üç pəhləvan yola düşüb, qanın rəddi ilə düz zülmət quyusunun başına gəldilər.* (Nağıl). *Bura bax, Nadir, – deyə* [Cə-

fər] *rəddi göstərdi: – Görürsənmi, aşağıdan gəlib, bu tərəfə burulub.* İ.Əfəndiyev.

**RƏDDEDİLMƏZ** *sif.* Rədd edilə bilməyən; əsaslı, sübutlu. *Rəddedilməz dəlil.*

**RƏDİF** *is.* [*ər.*] *ədəb*. Hər beytin axırında qafiyədən sonra təkrar edilən söz və ya söz birləşməsi. *M.V.Vidadinin* "*Gəl çəkmə cahan qeydini sən, can belə qalmaz*" *müsəddəsində* "*belə qalmaz*" *rədifdir.*

**RƏDİFLİ** *sif. ədəb*. Rədifi olan, rədiflə qurtaran. *Sabirin* "*Oxutmuram, əl çəkin!*" *rədifli şeri*.

**RƏF**[1] *is.* [*ər.*] Qab-qacaq və s. düzmək üçün evin divarına və ya şkafa şaquli vəziyyətdə vurulan taxta parçası, yaxud divar tikiləndə qoyulan şaquli çıxıntı. *Suvaqsız divarda qədim tüfənglər və qılınclar asılmışdı, rəflərdə pas basmış mis qablar üst-üstə yığılmışdı.* Çəmənzəminli. [Nuriyyə:] *Gözüm otağın yarımqaranlığına alışandan sonra adi taxtadan düzəlmiş rəflərdəki kitabları gözdən keçirdim.* İ.Əfəndiyev.

**RƏF**[2] *is.* [*ər.*] Qaldırma, aradan götürmə, rədd etmə, ləğv etmə, yox etmə. *Ən əvvəl lazım olan budur ki, öz ehtiyacatımızı dürüst bilib, tədriclə bunların rəfinə çalışaq.* F.Köçərli. ◻ **Rəf etmək** (köhnə forması: **rəf qılmaq**) – aradan götürmək, aradan qaldırmaq, yox etmək, ləğv etmək, rədd etmək. *Rəf qıl dərdimi, tut bir neçə camilə əlim; Saqiya, ol gözü xummardən oldum məyus.* S.Ə.Şirvani. *Poçt yolu ilə gəlib-gedənlərin hər ehtiyaclarını Rəhim bəy kəmali-məmnuniyyətlə rəf edirdi.* Ə.Haqverdiyev. **Rəf olmaq** – aradan qalxmaq, yox olmaq, yox olub getmək. *Yetişən zaman başa sinnü sal; Didarını görcək, rəf oldu məlal*. Q.Zakir. **Rəf olunmaq** – yox edilmək, yox olub getmək. *Ürəkdə həvəs cuş edəndə gözdən axan yaşla ürəkdəki ağırlıq rəf olunur*. S.M.Qənizadə.

**RƏFAQƏT** *is.* [*ər.*] Yoldaşlıq, dostluq. *Yox ikən sənlə bir rəfaqətimiz; Nərədəndir bu rütbə hörmətimiz?!* M.Ə.Sabir. *Yoxdur insafü sədaqət bizdə; Nə də düz-doğru rəfaqət bizdə.* A.Səhhət. ◻ **Rəfaqət etmək** – 1) yoldaşlıq etmək. [Xədicəyə] *rəfaqət edəcəkdim.* S.Hüseyn; 2) *məc*. həmişə bir yerdə olmaq, bərabər olmaq, müşayiət etmək.

**RƏFEDİCİ** *sif.* Rəf edən, aradan qaldıra bilən, öhdəsindən gələ bilən. *Məktəb elmli, bilikli, məişətin ehtiyacatını rəfedici .. adamlar yetirə bilməyir.* F.Köçərli.

**RƏFƏTƏ** *is.* Çörəyi təndirə yapmaq üçün alət. *Üzü pörtmüş şatır oxlovçunun verdiyi xəmiri əlindəki rəfətənin üstünə yayıb təndirə yapırdı.* P.Makulu.

**RƏFİQ** *is.* [*ər.*] Yoldaş, dost, arqadaş. *Yarım saatdan sonra neçə nəfər köhnə rəfiqlərlə Şaban daxil oldu.* Ə.Haqverdiyev. *Bir də rəfiqlərindən biri deyirdi ki, Ağəli xan yazıb, məndən yaranal sırması və şaşka istəmişdi*. Çəmənzəminli. *Güllər .. məktəb yoldaşını və onun rəfiqini gördü.* İ.Əfəndiyev.

**RƏFİQANƏ** *zərf* və *sif.* [*ər.* rəfiq və *fars.* ...anə] Yoldaşcasına, dostcasına. *Rəfiqanə hərəkət*. – [Müəllif:] *Bir azdan sonra biz rəfiqanə söhbət edirdik.* T.Ş.Simurq.

**RƏFİQƏ** *is.* [*ər.*] 1. Qız və ya qadının qız və ya qadın yoldaşı. *Vəfalı Hüsniyyə rəfiqəsinin yanını kəsdirib, sübhə qədər gözlərini yummadı.* S.S.Axundov. [Nuriyyə:] *İnstitutda oxuduğum zaman rəfiqələrim gündə bir dəst paltar geydikləri halda mən bütün ili bir donla başa vurdum.* İ.Əfəndiyev.

2. Qadın, zövcə, yoldaş (3-cü mənada). [Şair] *tifilə baxmadan əvvəl əyilib rəfiqəsinin solğun alnından öpdü*. Ə.Məmmədxanlı.

**RƏFİQƏLİK** b a x **bacılıq** 2-ci mənada. [Ziba:] *Çiçəyi bir ana qəlbi ilə tərbiyə etsəm, .. Həlimənin qabağında öz rəfiqəlik borcumu ödəmərəmmi?* S.Rəhimov.

**RƏFİQLİK** *is.* Yoldaşlıq, arqadaşlıq, dostluq.

**RƏFTAR** *is.* [*fars.*] Birisinə və ya bir şeyə qarşı göstərilən münasibət, davranış, hərəkət tərzi. *Yaxşı rəftar. Pis rəftar*. – [Vaqif Qızxanıma:] *Səndən xoş rəftardan başqa bir şey tələb etmirəm.* Çəmənzəminli. // Özünü aparma tərzi, özünü tutma qaydası. [Əşrəf bəy:] *Ancaq təvəqqe eləyirəm, mənim bu cür rəftarımı biədəb hesab eləməyəsiz.* N.Vəzirov. ◻ **Rəftar etmək (eyləmək)** – birisinə və ya bir şeyə qarşı bu və ya başqa cür münasibət göstərmək, hərəkət etmək, davranmaq, özünü aparmaq. *Sən muradım əksinə, ey çərx, rəftar eylədin*. S.Ə.Şirvani. *Aralıqda* "*cənnətin qəbzi*" *məsələsi olmasa idi, usta camadarla başqa cür rəftar edərdi*. Çəmənzəminli.

**RƏĞBƏT** [*ər.*] *is.* Meyil, təvəccöh. *Hazırda həm iqbal, həm də məmləkət xalqının rəğbəti Qızıl Arslanın tərəfindədir*. M.S.Ordubadi. ☐ **Rəğbət etmək (eləmək, bəsləmək)** – meyil etmək, təvəccöh göstərmək, üz göstərmək, yaxınlıq etmək. [Fatmanisə:] [Almaz] *məni nöşün götürür, mənə kim rəğbət eləyəcək*. C.Cabbarlı. *Firəngiz lap gənclikdən matadorlara rəğbət bəslərdi.* B.Bayramov.

**RƏĞBƏTLƏNDİRMƏ** "Rəğbətləndirmək"dən *f.is.*

**RƏĞBƏTLƏNDİRMƏK** *f.* Özünə cəlb etmək, istətmək, rəğbət hissi oyatmaq. *Uşağı rəğbətləndirmək.*

**RƏĞBƏTLİ** *sif.* Rəğbət hissi oyadan, xoşa gələn; yaxşı, abırlı. *Rəğbətli geyim.*

**RƏĞMƏN** *qoş.* ...baxmayaraq, ...əksinə (olaraq); ...isə də, ...diyi (duğu) halda; amma, yenə də. *Aslan, Mənsurun elmə həvəskar olmağına rəğmən onu oxutdururdu.* C.Cabbarlı. *Firuz bütün mətanəti və səbatına rəğmən dəniz sahilindəki qayalardan birinin arxasına düşdü.* H.Nəzərli.

**RƏHAVİ** *is.* [*fars.*] Klassik musiqidə muğam adı.

**RƏHBƏR** *is.* [*fars.*] 1. Hər hansı bir ictimai hərəkatın, partiyanın, sinfin ideoloqu, siyasi başçısı, yolgöstərəni. *Hərəkatın rəhbərləri*.

2. Bir işin başında duran, onu idarə edən adam; başçı. *Dram dərnəyinin rəhbəri. Şöbənin rəhbəri. – Jurnalın rəhbəri Cəlil Məmmədquluzadə bütün qüvvə və enerjisini, bütün fikir və vaxtını jurnala həsr etmişdi*. M.İbrahimov. [Məmmədsadıq:] *Səməndər elə rəhbərə rast gəlib ki, tükənməz bir xəzinədir.* B.Bayramov.

3. Yolgöstərən. *Sən olmasan verəməzdim mən eşqə bir məna; Bu yolda sən mənə rəhbərsən, eyləməm inkar*. H.Cavid.

4. *köhn.* Arayış, məlumat kitabı; bir fənni, dili öyrənmək üçün kitabça. *Rəhbəri-cəbr*.

**RƏHBƏRLİK** *is.* Bir işin başında durma, yol göstərmə. *Partiyanın rəhbərliyi.* ☐ **Rəhbərlik etmək** – başçılıq etmək, bir işin başında durmaq, yol göstərmək. *Bu halda əvvəlki gün mənə rəhbərlik edən ixtiyar qadın qarşıma çıxdı*. S.Hüseyn.

**RƏHM** *is.* [*ər.*] Acıma, yazığı gəlmə, ürəyi yanma; mərhəmət. *Şahın zülmü yüz olar; Rəhmini görən olmaz.* (Bayatı). *Onun heç bir rəhmi, insafı yoxdurmu?* M.S.Ordubadi. ☐ **Rəhm etmək** (köhnə forması: **rəhm qılmaq**) – yazığı gəlmək, halına acımaq, ürəyi yanmaq, mərhəmət etmək. *Yandırma mənim canımı, öz canına rəhm et*. Qövsi. *Vaqifə rəhm eylə, bari, ilahi; Agah et dərdindən ol üzü mahi.* M.P.Vaqif. *Sənə nə qədr dedim, rəhm qıl mənə, getmə*. X.Natəvan. **Rəhm oyanmaq** – b a x **rəhmə gəlmək**. [Nərgiz:] *Qəsdən dayandım ki, bəlkə ürəyimə qan gələ, rəhm oyana.* B.Bayramov. **Rəhmə gəlmək** – acımaq, yazığı gəlmək, ürəyi yanmaq. *Aşiqinə qanlar ağladan dilbər; Rəhmə gəlib göz yaşını silməzmi?* M.P.Vaqif. [Balaş Gülüşə:] *Müqəssir mən özüməm, bacıcan, mənə rəhmin gəlsin.* C.Cabbarlı. **Rəhmə gətirmək** – insafa gətirmək, ürəyində mərhəmət hissi oyandırmaq. **Rəhmi gəlmək** – b a x **rəhm etmək**. [Sultan bəy:] [Arşınmalçının] *amma xalasını alardım və bir söz deyən olsa idi, deyərdim ki, bir fağır dul arvad idi, rəhmim gəldi, aldım*. Ü.Hacıbəyov. *Sənubərin sinəsi qabardı, anasına rəhmi gəldi*. B.Bayramov.

**RƏHMDİL(Lİ)** *sif.* [*ər.* rəhm və *fars.* dil] Ürəyi rəhmli, ürəyinazik, ürəyiyumşaq. *Qaraca qızın ürəkyandırıcı faciəsindən rəhmdil Piri kişi xeyli qəmgin oldu.* S.S.Axundov. *Mən sənin bir rəhmdil səyyadınam, gəl qoynuma; Gəl öpüm, gəl oxşayım, ey nazənin ahu, səni.* M.Müşfiq.

**RƏHMDİLLİK** *is.* Ürəyinaziklik, mərhəmətlilik, rəhmlilik, şəfqətlilik. *Kürdüstan dağlarında bəslənmiş elmsiz, tərbiyə görməmiş bir qızda bu qədər rəhmdilliyə .. heyran qalıram.* S.S.Axundov. *Qaçayı fəhlələrə sevdirən isə onun rəhmdilliyi, hamıya bir növ ağsaqqallıq etməsi idi.* Ə.Vəliyev.

**RƏHMƏT** *is.* [*ər.*] *klas.* 1. Yazığı gəlmə, rəhm etmə, mərhəmət.

2. *məc.* Nemət, bərəkət mənasında. *Alqış sənə, ey zəhmət; Dünyaya saçan rəhmət; Sənsən bu əməklərlə*. A.Şaiq.

3. *məc.* Dindarların etiqadına görə, Allahın mərhəmətinin təzahürü olaraq yağan xeyirli yağış.

4. Müsəlman dininə görə Allahın ölülərə rəhm edib günahlarını bağışlaması. ☐ ...**rəhmət**! – Allah ... günahından keçsin! *Gərçi, ey dil, yar üçün üz verdi yüz möhnət sana;*

*Zərrəcə qəti-məhəbbət etmədin, rəhmət sana.* Füzuli.

◊ **Rəhmət demək (oxumaq)** – yaxşılıqla anmaq, yaxşılığına danışmaq. *Düşmən düşmənə rəhmət oxumaz ki... – Sanma varis mənə rəhmət oxuyub heyf çəkər.* M.Ə.Sabir. [Mirzə Heydər:] *Cəmi-aləm* [atama] *rəhmət oxuyur*. Ə.Haqverdiyev. [Qara kişi:] *Gərək hamıya yaxşılıq eləyəsən ki, öləndə hamı rəhmət desin*. B.Bayramov. **Rəhmət etmək** – bax **rəhmətə getmək**. **Rəhmətə getmək** – ölmək. *Vaxt yetişdi, anası .. rəhmətə getdi; Bu həsrətin ağrısını duydu Əmirxan*. S.Vurğun. **Allah rəhmət eləsin!** – təsəlli və təziyə ifadəsi. *Yazıq Molla Tanrıqulu, Allah sənə rəhmət eləsin!* C.Məmmədquluzadə. [Molla Əkbər:] *Bu tarçı .. Əsəd deyildi... Tanrıçı Əsəd idi... Yaxşı adam idi. Allah rəhmət eləsin...* B.Talıblı. **Allah(ın) rəhmətinə getmək** – bax **rəhmətə getmək**. [Səkinə xanım:] *Qardaşım Allahın rəhmətinə getdi.* M.F.Axundzadə.

**RƏHMƏTLİK** *is.* 1. Adı çəkilməyərək nəzərdə tutulan ölmüş şəxs; mərhum. *Rəhmətlik məni çox istərdi, çünki məndən savayı bir özgə övladı yox idi.* C.Məmmədquluzadə. [Cahan:] *İndi Allah bilir ki, nə iş görür, rəhmətlik on iki ildir ki, ölübdür.* Ü.Hacıbəyov.

2. Bu söz vəfat etmiş adam xatırlanarkən adının ya əvvəlinə, ya sonuna gətirilir. [Qənbərqulu:] *Rəhmətlik bibim buranın ağası olanda Cavadın atası ağsaqqal qoca bir kişi idi*. B.Talıblı. *Rəhmətlik qoca nənəm demişkən, tərpənib yeriyəndə elə bilərdin o yandan bir ağmaya gəlir.* İ.Əfəndiyev.

3. Yaşlı adama xitab, müraciət (tərkibdə işlənir, həm də narazılıq, məmnunsuzluq ifadə edir). [Sərnişin:] *Sən də bu basabasda tramvaya yeşik çıxardırsan, ay rəhmətlik oğlu*. Qantəmir. *Ah rəhmətlik balası, başını qoyub yatsana.* H.Nəzərli.

**RƏHMKAR** *sif.* [*ər.* rəhm və *fars.* ...kar] Rəhmli. [Şah Abbas] *çox rəhmkar şahdır*. "Qurbani".

**RƏHMSİZ** *sif.* və *zərf* Rəhm bilməyən; mərhəmətsiz, insafsız, amansız. *Rəhmsiz adam. Rəhmsiz baxışlar. – Jandarmların rəhmsiz sifəti, çapqın, talan, qanlı xəncərlər* [Telli xalanın] *gözü önündə dikəlirdi.* Mir Cəlal. *Qəhrəman ona sərt və rəhmsiz baxışlarla baxırdı*. Ə.Vəliyev.

**RƏHMSİZLİK** *is.* Mərhəmətsizlik, amansızlıq, insafsızlıq. *Rəhmsizlik etmək.*

**RƏHN** *is.* [*ər.*] 1. Girov. *Onun bütün əmlakı rus bankının rəhnindədir*. M.S.Ordubadi. [Hacı Vəli:] *Evində iki otaq dolusu rəhn qoyulmuş şeylər var idi*. Çəmənzəminli.

2. *məc.* Əsas, şərt, mənbə. *Təmizlik sağlamlığın rəhnidir. Birlik qalibiyyətin rəhnidir.*

**RƏHNÜMA** *is.* [*fars.*] *klas.* Yolgöstərən, bələdçi. *Ümmətin rəhnüması tərbiyədir; Millətin pişvası tərbiyədir.* M.Ə.Sabir. // **Rəhnümasilə** şəklində – müşayiəti ilə. *Yengələr .. dərhal ayağa qalxaraq alafa altına alınmış gəlini qız yengələrinin rəhnümasilə evdən çıxarardılar.* R.Əfəndiyev.

**RƏXNƏ** *is.* [*fars.*] 1. Yıxıq, dağınıq yer, çökmüş yer.

2. *məc.* Zərər, ziyan. ☐ **Rəxnə salmaq** – çaxnaşma salmaq, qarma-qarışıqlıq salmaq, vəlvələ qopartmaq. *İlahi rəxnə salmasın; Bu qurğu, dövrana, deyin*. Aşıq Ələsgər. **Rəxnə vurmaq (yetirmək)** – ziyan vurmaq, zərər yetirmək; dağıtmaq, pozmaq, kökünü tərpətmək. *Məzhəbə rəxnə vurub, dinə salardı fəsad*. M.Ə.Sabir. *Ağır və məşəqqətli həyat* [Araz və Günəşin] *ailə həyatının sağlam təməlinə zərrə qədər rəxnə vura bilməmişdi.* A.Şaiq. *Heyf, səd heyf ki, ittifaqı pozan və* [birliyin] *bünövrəsinə rəxnə yetirən əvvəlcə o kəslər oldu ki, maarifpərvərlik ismini üstlərinə götürüb rəyasətlik iddiasındadırlar.* F.Köçərli. **Rəxnə yetişmək** – dağılmaq, pozulmaq, kökü sarsılmaq. *Az qaldı ki, evin bünövrəsinə rəxnə yetişsin ki, nagah dərviş mənzilə qayıtdı*. M.F.Axundzadə.

**RƏXNƏLƏNMƏ** "Rəxnələnmək"dən *f.is.*

**RƏXNƏLƏNMƏK** *f.* Dağılmaq, sökülmək; kökündən sarsılmaq, ziyan çəkmək.

**RƏXNƏLƏNMİŞ** *f.sif.* Sökülmüş, dağılmış, kökündən sarsılmış; ziyan görmüş. *Rəxnələnmiş həsarü divarı; Səqfi çökmüş, qədimi asarı.* A.Səhhət. *Qışda uçmuş damlar qayrılır, rəxnələnmiş hasarlar təmir olunub düzəlirdi*. S.Hüseyn.

**RƏXT** *is.* [*fars.*] *köhn.* 1. Minik atına lazım olan şeylər. [Heydər bəy:] *Əmiraslan bəyin övladı genə dünən də Ağcabədi bazarında*

*dədələri osmanlıda qəsb etdiyi gümüş rəxtlərdən satırdılar.* M.F.Axundzadə.

2. Döşənəcək, yataq. *Ötkün sözüm, kəskin baxtım olaydı; Ağ otağım, zərrin rəxtim olaydı.* Aşıq Ələsgər.

**RƏXTXAB** *is.* [*fars.*] Yataq, yorğan-döşək. *Güləndam rəxtxab götürüb getdi balaca otağa.* Ə.Haqverdiyev. *Axund o biri otağa girəndən sonra barmaqlarının ucunda yeridi, ipək rəxtxaba girdi.* Mir Cəlal.

**RƏİS** *is.* [*ər.*] İdarə edən, rəhbərlik edən, başçılıq edən adam. *Milis rəisi. Sex rəisi.* – [Çeşməkli kişi:] *Mən bu tikintinin rəisini axtarıram.* S.Rəhman. *İş ilə tanış olandan sonra Vahidi axırıncı dəfə rəis özü dəyişdirdi.* Mir Cəlal. // Başçı, müdir. *Şamaxı realni məktəbinin rəisi Şamaxıya gələn kimi əvvəl bir müsəlmanlar ilə dadışdı..* C.Məmmədquluzadə. *Hasılı Hacı Aslan çox böyük adam idi; çünki o, nüfuzlu bir məhəllə rəisi və ağsaqqalı idi.* S.Hüseyn. // *köhn.* Bir heyət və ya məclisin başında duran şəxs; sədr. *Vəkillər heyəti rəisi. Hökumət rəisi.*

**RƏİSLİK** *is.* Rəis vəzifəsi; başçılıq, rəhbərlik.

**RƏİYYƏT** *is.* [*ər.*] Bir dövlətin tabeliyində olan(lar); təbəə. *Atabəy Məhəmməd, Marağa və Təbrizi alandan sonra şəhərlərə qasidlər göndərib, rəiyyətlərinə böyük qələbənin xəbərini elan etdirdi.* M.S.Ordubadi. // Aşağı təbəqədən olan, yoxsul adam. *Böyük-kiçik, rəiyyət, xanım, ağa; Yapışdılar hər biri bir peşəyə.* A.Səhhət. [Şahnisə Vaqifə:] *Kaş əliqabarlı bir rəiyyət olaydım, balalarım da gözümün önündə olaydı.* Çəmənzəminli.

**RƏİYYƏTPƏRVƏR, RƏİYYƏTPƏRƏST** *sif.* [*ər.* rəiyyət və *fars.* ...pərvər, ...pərəst] *köhn.* Öz rəiyyətini sevən, onun rifahına çalışan. *Atabəylər rəiyyətpərvər deyildir.* M.S.Ordubadi. *Möhsün .. özünü hər yerdə, hər bir məclisdə rəiyyətpərəst* (z.) *göstərir.* S.Rəhimov.

**RƏQABƏT** *is.* [*ər.*] 1. Hər hansı bir sahədə eyni məqsədi əldə etmək üçün ayrı-ayrı şəxslər arasında mübarizə, çəkişmə. ☐ **Rəqabət aparmaq (etmək)** – 1) üstünlük qazanmaq üçün cəhd etmək, mübarizə aparmaq (etmək); 2) *məc.* bərabər olmağa çalışmaq, geri qalmamaq, yarışmaq. *Kürdüstan qızlarının gözləri dağlarda marallarla, çöllərdə ceyranlarla rəqabət edir.* H.Nəzərli.

2. Əmtəə istehsalında: əmtəəni daha mənfəətlə istehsal etmək və satmaq üçün xüsusi istehsalçılar arasında mübarizə, yarış; kapitalizm şəraitində – daha çox mənfəət götürmək üçün kapitalistlər arasında mübarizə. *Böyük sərmayəyə malik olan əcnəbi şirkətləri ilə yerli neft sahibləri rəqabət edə bilməzlər.* M.S.Ordubadi. *Müftə qazanca dadanmış qoçular arasında rəqabət gedirdi.* A.Şaiq.

**RƏQƏM** *is.* [*ər.*] 1. Ədədlərin, sayların yazıda işarəsi. *3 rəqəmi. 15 rəqəmi.* – [Fərman] *qabağına bir kağız qoyaraq, karandaşla bir çox rəqəm yazır və hesablayırdı.* Ə.Sadıq. *Rəqəmlər düzülüb yan-yana; İkiylə başlayanı var; üçlə başlayanı var; hələ beşi, yeddini demirəm.* R.Rza. ☐ **Ərəb rəqəmləri** – orta əsrlərdə ərəblərdən əxz olunmuş 1, 2, 3, 4 və b. rəqəmlər. **Roma rəqəmləri** – qədim romalılardan əxz olunmuş I, II, III, IV və b. rəqəmlər.

2. *klas.* Yazı, yazı ilə qeyd, işarə. ☐ **Rəqəm etmək (qılmaq)** *klas.* – 1) yazmaq, yazı ilə işarə etmək. *Bir naməyə dərdimi rəqəm qıl; Sultanıma ərz et, kərəm qıl!* Füzuli; 2) şəkil çəkmək. **Rəqəm olunmaq** *klas.* – 1) yazılmaq, yazı ilə işarə olunmaq; 2) şəkil çəkilmək, çəkilmək. *Beşinci otağın divarlarında Şah İsmayıl Səfəvi ilə sairlərin mabeynində vaqe olan cənglərin surəti rəqəm olunmuşdu.* M.F.Axundzadə.

**RƏQİB** *is.* [*ər.*] 1. Eyni şeyi tələb edən, istəyən, arzu edən şəxslərdən hər biri. [Gülüş Dilbərə:] *Görürsünüz ki, rəqibiniz nə qədər gücsüzdür.* C.Cabbarlı. *Heç o qədər də arzulamadığı və rəqibi olan qonağın – Aslan bəyin gəlişi Qasım bəyi açmadı.* A.Şaiq. // Bir qıza vurulan aşiqlərdən hər birinə nisbətən hər biri.

2. İdman yarışlarında iştirak edənlərdən hər biri; qarşı tərəf. *Rəqibə ciddi müqavimət göstərmək. – Məmməd rəqibindən cəmisi bir sinə irəli keçib yarışı aparmışdı.* H.Seyidbəyli.

**RƏQİQ** *is.* [*ər.*] *köhn.* 1. İncə, nazik.

2. *məc.* Hər şeydən mütəəssir olan, həssas.

**RƏQQAS**[1] *is.* [*ər.*] Rəqs edən, oynayan; balet artisti. *Eh, keçən günlərim, keçən gün-*

*lərim; Deyib qoca rəqqas ah çəkdi; Yenə...* B.Vahabzadə.

**RƏQQAS²** *is.* [*ər.*] Saatların mexanizminin hərəkətini təmin etmək üçün aşağı ucuna ağırlıq, yuxarı ucu isə sabit nöqtəyə bənd edilmiş olan hərəkət edən mil; kəfkir. *Divar saatının rəqqası.* // Cib və qol saatlarında bu vəzifəni görən yaylı çarx.

**RƏQQASƏ** *is.* [*ər.*] Rəqs edən, oynayan qız, qadın; balerina. *Musiqi çalınır, rəqqasələr rəqs edirlər.* M.S.Ordubadi.

**RƏQQASƏLİK** *is.* Rəqqasənin işi, sənəti; balerinalıq.

**RƏQQASLIQ** *is.* Rəqqasın işi, sənəti.

**RƏQS** *is.* [*ər.*] 1. Musiqinin tempinə uyğun olaraq ritmik bədən hərəkətlərindən ibarət incəsənət növü. *Azərbaycan xalq rəqsləri. – Rəqs insanların hələ çox qədim zamanlarda yaratdığı bir sənətdir.* Ə.Bədəlbəyli. [Bəhram:] *Nə gözəldir bu rəqslər! Könüllərdən qaçır kədər.* A.Şaiq. ☐ **Rəqs etmək** – rəqs ifa etmək; oynamaq. *Axışıb gələn dəstələr həyətdə toplanır, çal-çağır başlayır, gənclər yallı tutub rəqs edirdilər.* S.Rəhimov. *Qızlar əlvan paltar geyib; Rəqs edirlər qoşa-qoşa.* M.Dilbazi.

2. Həmin hərəkətlərin ritm, üslub və sürətinə uyğun musiqi əsəri. *Bramsın macar rəqsləri.*

3. İştirakçıların belə hərəkətləri ifa etdikləri, oynadıqları şənlik, əyləncə. *Klubda rəqs gecəsi təşkil olunmuşdu.*

**RƏQSÇİ** b a x **rəqqas¹**.

**RƏQSÇİLİK** b a x **rəqqaslıq**.

**RƏMƏ** *is.* [*fars.*] Sürü. Qoyun sürüsü.

**RƏMƏL** *is.* [*ər.*] Əruz vəznində şeir forması. *Mikayıl Müşfiq heca vəzninin bütün bölgülərində* (*üç hecalıdan tutmuş iyirmi hecalıya qədər*), *əruz vəzninin əsasən həzəc və rəməl bəhrlərində əsərlər, eləcə də sərbəst şeirlər yazmışdır.* G.Hüseynoğlu.

**RƏML** *is.* [*ər.*] Rəmmalların qum üzərində müxtəlif işarələr çəkərək və ya başqa üsullarla fala baxıb gələcəkdən xəbər verməsi. ☐ **Rəml atmaq** – qum üzərində müxtəlif işarələr çəkmək və ya başqa üsulla fala baxmaq. *Bir küy düşdü ki, məşhur Seyid Mircəfər ağa rəml atıb hamını bu sirdən agah edəcək.* Çəmənzəminli.

**RƏMLÇİ** b a x **rəmmal**. [Vəzir dedi:] *Şah sağ olsun, bir rəmlçi tapmışam ki, yerin altını da bilir, üstünü də.* (Nağıl).

**RƏMMAL** *is.* [*ər.*] Rəml atan (bax **rəml**); falçı; rəmlçi. *İnanma gər desə rəmmal, sirri-qeybə agahəm.* S.Ə.Şirvani. [Hünər:] *Rəmmal deyib, yalnız qılınc; Mən də inanıram rəmmal deyənə.* M.Rahim. *Durub rəml atdırır rəmmalə, bəxti qarə iranlı.* Şəhriyar.

**RƏMMALLIQ** *is.* Rəmmalın peşəsi; falçılıq, rəmlçilik.

**RƏMZ** *is.* [*ər.*] 1. Bir fikri və ya anlayışı ifadə edən rəsm, şəkil, hərf və s. işarə. *Göyərçin sülh rəmzidir. – Bu həqiqi və kamil bir sənət əsəri deyildisə də, lakin sadə və təsiredici rəmzlərlə dolu bir tablo idi.* Ə.Məmmədxanlı.

2. İşarə ilə anlatma; işarə. *Rəmz anlayan, söz düşünən, dərd bilən; Aləmlərdə şöhrətlənir, bəllənir.* "Qurbani".

3. *xüs.* Bu və ya başqa bir fəndə qəbul edilmiş hər hansı bir kəmiyyətin şərti işarəsi; simvol.

**RƏMZİ** *sif.* [*ər.*] Rəmzlə ifadə olunan, işarə ilə, dolayı yolla bildirilən; üstüörtülü. *Rəmzi məna. – Sənətin, hünərin rəmzidir dağlar; Bizləri eşq ilə sənətə bağlar.* Şəhriyar.

**RƏNA** *sif.* və *is.* [*ər.*] *şair.* 1. Gözəl (qız, qadın). *Kim bilir, yollarında, ey rəna! Nə qədər, uf, boyun bükənlər var.* A.Şaiq.

2. Gözəl, lətafətli, qəşəng. *Bu haman rəna qəzəldir ki, Nəvai söyləmiş.* Qövsi. *Kələğayı gülgəz, libası əlvan; Bir güli-rənadır mənim sevdiyim.* M.P.Vaqif.

**RƏNALIQ** *is.* *şair.* Gözəllik, göyçəklik, qəşənglik. *Qopar qiyaməti sərvin girəm gülüstanə; İnanma sərv, sənubərdə var bu rənalıq.* M.S.Ordubadi.

**RƏNC** *is.* [*fars.*] *klas.* 1. Əziyyət, zəhmət. *Ah, bizlər çocuq ikən nə qədər; Vermişik validеynə rəncü kədər!* M.Ə.Sabir. *Nə çox vaxt xırman döyəndə yazığın* [taybuynuz öküzün] *ağzını da bağlayırlar ki, belə rənc və zəhmətlə döydüyü arpa-buğdanın küləşindən və ələfindən yeməsin.* F.Köçərli.

2. Zəhmət, əmək. [Qərib:] *Gəl sən mənə izin ver gedim, öz əlimin rənci ilə qırx kisə qızıl qazanım..* "Aşıq Qərib".

**RƏNCBƏR** *is.* [*fars.*] 1. Taxıl əkib becərməklə məşğul olan kəndli; əkinçi, taxılçı. *İş*

*rəncbərin, güc öküzün, yer özününkü; Bəyzadələri, xanları neylərdin, ilahi?!* M.Ə.Sabir. [Molla Xəlil] *gərək adi bir rəncbər kimi xışın dəstəsindən yapışsın, əkinçiliyə başlasın.* S.Hüseyn.

2. Zəhmətkeş, əməkçi kəndli. [Mirzə:] *Bəylərin, xanların yerləri hamısı əllərindən alınıb camaata, rəncbərlərə verilir*. Ə.Haqverdiyev. *Ədhəm kişi ucaboylu, enlikürəkli, həddindən artıq genişalınlı, iri gözlərilə olduqca mehriban təsir buraxan bir rəncbər idi*. M.Hüseyn.

**RƏNCBƏRLİK** *is.* 1. Rəncbərin işi, peşəsi; əkinçilik, taxılçılıq. *Kəndlilər rəncbərlik, maldarlıq və bağbançılıqla yarıac həyat sürərdilər.*

2. Zəhmətkeşlik, əməkçi kəndli. [İmdad:] *Atamız* [Paşa bəyin] *atasına, özümüz özünə rəncbərlik eləyib, bəhrə vermişik.* Ə.Vəliyev.

**RƏNCİDƏ** [*fars.*] bax **incik**. [Qadın:] *Xudahafiz. Mənim ərim bir qədər tündməcazdır. Xahiş edirəm rəncidə olmayasınız.* Ə.Haqverdiyev. ☐ **Rəncidə etmək (salmaq)** – incitmək, küsdürmək, ürəyini sındırmaq. *Rəncidə elə xalqı, danış acı zəhərtək; Şirin danışar isə gər insan, nəyə lazım?* Ə.Vahid. **Rəncidə olmaq** – incimək, ürəyi sınmaq, küsmək. [Zöhrə xanım:] *Biz Çingizdən rəncidə olmuruq*. S.S.Axundov. *Şəfiqə cavab verdi ki, məndən rəncidə olub getdi*. İ.Musabəyov.

**RƏNCİDƏQƏLB, RƏNCİDƏXATİR, RƏNCİDƏHAL** *sif.* və *zərf* [*fars.* rəncidə və *ər.* qəlb, xatir, hal] İncik, incimiş, küskün, küsmüş. *Belə şübhəli və bir az da rəncidəxatir xan durub darvazadan çıxdı*. Çəmənzəminli. *Lakin müvəkkil rəncidəhal gedirdi*. B.Bayramov. ☐ **Rəncidəqəlb (rəncidəxatir, rəncidəhal) etmək** – incitmək, küsdürmək, qəlbini sındırmaq. **Rəncidəqəlb (rəncidəxatir, rəncidəhal) olmaq** – incimək, küsmək, qəlbi sınmaq. [Şah:] *Hacı, deyəsən, məndən rəncidəxatir oldun*. Ə.Haqverdiyev. *Xanım, Qulam müəllimin rəncidəhal olduğunu görüb gülümsündü..* S.Rəhimov.

**RƏNCİDƏLİK** *is.* İnciklik, küskünlük, küsmə, incimə. [Müstəntiq:] *Paşa bəylə pristav Kamalın arasında inciklik, rəncidəlik vardırmı?* Ə.Vəliyev.

**RƏNDƏ** *is.* [*fars.*] Taxtanı yonub hamarlamaq üçün dülgər aləti. [Fərmanın] *atasından qalan rəndə və əl mişarının dəstəsi xurcunun ağzından görünürdü.* Ə.Sadıq. *Balta taqqıltıları, rəndə səsləri bir-birinə qarışmışdı.* İ.Şıxlı.

**RƏNDƏLƏMƏ** "Rəndələmək"dən *f.is.*

**RƏNDƏLƏMƏK** *f.* 1. Taxtanı rəndə ilə yonub hamarlamaq, rəndədən keçirmək. *Bir yanda xarratlar taxta yonub rəndələyir, qapıpəncərənin çərçivəsini yerinə salır, döşəməni düzəldirdilər*. M.İbrahimov. *Qoca xarrat qutuları; Rəndələyib verdi sığal.* M.Dilbazi.

2. *məc.* Ora-burasını düzəltmək, yaxşı şəklə salmaq, qaydaya salmaq, abıra salmaq. *..Belə çirkin adətləri rəndələmək, özü də əməlli-başlı rəndələmək lazımdır.* // *məc.* Tərbiyələndirmək; kobud, qaba cəhətlərini bir qədər yumşaltmaq, azaltmaq. *Zaman onu xamır kimi; kündələdi; Yaman onu rəndələdi...* B.Vahabzadə.

**RƏNDƏLƏNMƏ** "Rəndələnmək"dən *f.is.*

**RƏNDƏLƏNMƏK** *məch.* 1. Rəndə ilə yonulub hamarlaşdırılmaq, yaxud rəndə ilə kəsilmək.

2. *məc.* Ora-burası düzəldilmək, yaxşı şəklə, qaydaya salınmaq.

**RƏNDƏLƏTDİRMƏ** "Rəndələtdirmək"dən *f.is.*

**RƏNDƏLƏTDİRMƏK** bax **rəndələtmək**.

**RƏNDƏLƏTMƏ** "Rəndələtmək"dən *f.is.*

**RƏNDƏLƏTMƏK** *icb.* Rəndə ilə yondurub hamarlatdırmaq. *Taxtaları rəndələtmək*.

**RƏNG** *is.* [*fars.*] 1. Bir şeyin işıq tonu. *Tünd rəng. Qırmızı rəng. – Çöllər yuxudan olunca bidar; Min rəng çiçəklə doldu gülzar*. A.Şaiq. *Xoşdur mənə, xoşdur bu təbiətdəki rənglər*. S.Rüstəm. ☐ **Rəngi qaçmaq (getmək)** – öz təbii rəngini itirib bozarmaq, ağarmaq, solmaq. *Kosanın şapkası günün və yağmurun təsirindən rəngi qaçmış, əyilərək təsəyə dönmüşdü.* S.Rəhimov. *Mənə aynabəndin rəngi getmiş qapısını açmaq kifayət idi ki, onu görüm*. Ə.Məmmədxanlı. **...rəngə çalmaq** – bir rəng vermək, bu və ya digər rəngə oxşamaq. *Hər rəngə çalan cürbəcür cücülər otlara mərcan kimi sarılmışdı.* S.S.Axundov. *Tahirin yanaqları bozumtul rəngə çalırdı*. M.Hüseyn. **Rəngi qaçmış** –

öz rəngini itirmiş; ağarmış, bozarmış. *Rəngi qaçmış çit. Rəngi qaçmış paltar*.

2. B a x **boya** 1-ci mənada. *Yağlı rəng. Sulu rəng. – Dəftərdə qəşəng rənglə çəkilmiş quş, pişik və it şəkli vardı*. Ə.Vəliyev.

3. Qadınların dodaqlarına, üzlərinə çəkdikləri, əsasən, qırmızı boya. *Dodağına rəng çəkmək*.

4. *məc*. Xüsusiyyət, zahiri görünüş, təzahür forması. *..Həyat öz rəngini və ahəngini dəyişməkdədir*. M.İbrahimov. *Varlığın rəngi sənsən, ahəngi sənsən; Çiçəklərin, nurların çələngi sənsən*. M.Müşfiq.

5. *mus*. Muğamatda təsnifdən sonra, bəzən və müstəqil olaraq çalınan musiqi parçası. *Rəng çalmaq*.

◊ **Rəng korluğu** *tib*. – b a x **daltonizm**. *Rəng korluğu xromatik rəngləri duymağı və fərqləndirməyi bacarmamağa deyilir*. M.Məhərrəmov. **Rəng verib rəng almaq** – 1) b a x **rəngdən-rəngə girmək (düşmək)**. *Dünən yağan şiddətli yağışdan sonra İncəli dərəsinin hər iki yanı rəng verib rəng alırdı*. M.Hüseyn; 2) *məc*. pərtlikdən, hirsdən və s. qızarmaq, bozarmaq, pörtmək. *..Ruqiyyənin üzünə baxdım, yanaqları rəng verib rəng alırdı*. A.Divanbəyoğlu. *Hacının gecikməsinə qonaqlardan artıq Minaxanım əsəbiləşir, qəlbindəki sıxıntı və çırpıntıdan rəng verib rəng alırdı*. A.Şaiq. **Rəng vermək** – başqa cür yozmaq, başqa məna vermək, deyildiyi kimi deyil, özü istədiyi kimi mənalandırmaq, rəng yaxmaq. *Cəhd eylə, verilməsin sənə rəng! Derlər, səni eşqə mübtəlasan*. Füzuli. *Sabahdan bu işə min rəng verib bazarda danışdılar*. Çəmənzəminli. **Rəng yaxmaq** – böhtan atmaq, ləkələmək. **Rəngdən-rəngə girmək (düşmək)** – 1) müxtəlif rənglər vermək, müxtəlif rənglərə çalmaq, tez-tez rəngi dəyişmək. *Qızlar bütün bəzəklərini taxmışlar, üst-başları rəngdən-rəngə girərək alışıbyanır*. S.Rüstəm; 2) *məc*. öz cildini dəyişmək, mühitə uymaq, dondan-dona girmək. ...**rəngə girmək (düşmək)** – b a x **rəngdən-rəngə girmək (düşmək)** 2-ci mənada. [Muxtar] *özünü qarşısındakı adama bəyəndirib sevdirmək üçün hər rəngə müvəffəqiyyətlə girə biləcək bir istedada malik idi*. S.Hüseyn. **Rəngi üzündən götürülmək** – b a x **rəngi qaçmaq**. *Cümşüdün rəngi üzündən götürülmüşdü, xan ilə yalqız otaqda qalmaq ən böyük bir əzab idi*. Çəmənzəminli.

**RƏNGARƏNG, RƏNGBƏRƏNG** *sif*. [*fars*.] 1. Müxtəlif rənglərdə olan; müxtəlifrəngli, əlvan. *Rəngarəng pəncərələrdən içəri düşən işıq məbədin daxili gözəlliyini bir qat daha artırmışdı*. Çəmənzəminli. *Bağban gəlib salam verdi və bir dəstə rəngbərəng qərənfilin bir hissəsini qonağa, bir hissəsini də mənə verdi*. T.Ş.Simurq.

2. Cürbəcür, müxtəlif, növbənöv, müxtəlifnövlü. *Pişxidmətlər rəngarəng təamlar hazır etdilər*. M.F.Axundzadə.

**RƏNGARƏNGLİK, RƏNGBƏRƏNGLİK** *is*. 1. Rəngarəng (rəngbərəng) şeyin halı və görünüşü; əlvanlıq.

2. Müxtəliflik, cürbəcürlük. *Baletin kütləvi janr və qəhrəmanlıq səhnələri öz müstəsna dinamikliyi, rəqs vasitələrinin orijinallığı və rəngarəngliyi ilə fərqlənir*. S.Hacıbəyov.

**RƏNGİN** *sif*. [*fars*.] *şair*. Rəngli, əlvan. *Hanı rəngin çiçəklərin, çəmən? Bir gözəl dəstə gül tutaydım mən*. A.Şaiq. *Əlvan boyalı yarpaqlarla, rəngin ipək xalılarla döşənmiş kimi görünən meşə indi tutqun, bozumtul bir rəng almışdı*. M.Rzaquluzadə.

**RƏNGKAR** [*fars*.] b a x **boyakar**. *Rəngkar rəssam*.

**RƏNGKARLIQ** b a x **boyakarlıq**.

**RƏNGLƏMƏ** "Rəngləmək"dən *f.is*.

**RƏNGLƏMƏK** *f*. Bir şeyin üzünə rəng sürtmək, boya çəkmək, yaxud onu boyanın içinə salaraq müəyyən bir rəng vermək; boyamaq. *Divarı rəngləmək. Yunu rəngləmək*. – [Qızyetər Şirzada:] *Biz də köhnə taxıl anbarını rəngləmişik, elə bilirik qəhrəmanlıqdır*. M.İbrahimov.

**RƏNGLƏNMƏ** "Rənglənmək"dən *f.is*.

**RƏNGLƏNMƏK** *məch*. Rəng çəkilmək, rəng sürtülmək, boyadılmaq. [Məntəqənin] *qapı-pəncərələri və üstüaçıq taxta balkonları rənglənməmişdi*. Ə.Sadıq. *Evlərimiz təmiz olur; Rənglənəndə döşəməsi*. M.Dilbazi.

**RƏNGLƏTDİRMƏ** "Rənglətdirmək"dən *f.is*.

**RƏNGLƏTDİRMƏK** *icb*. Rəng (boyaq) çəkdirmək; boyatmaq. *Divarları rənglətdirmək*.

**RƏNGLƏTMƏ** "Rənglətmək"dən *f.is.*

**RƏNGLƏTMƏK** *icb.* Rəng (boyaq) çəkdirmək; boyatmaq. *Jaketi rənglətmək. Otağı rənglətmək.*

**RƏNGLƏYİCİ** *sif.* Rəngləmək üçün işlədilən; boyayıcı. *Rəngləyici maddələr.*

**RƏNGLİ** *sif.* 1. Rənglənmiş, rəng çəkilmiş; boyalı. *Rəngli pəncərə. – Binanın adına layiq işıqlı bir şey vardısa, o da təzəcə salınmış rəngli qapısı idi.* M.İbrahimov.

2. Müxtəlifrəngli, rəngarəng, rəngbərəng, əlvan. *Salman kişi* [Aqilə] *çoxlu dəftər, rəngli qələm alacağını vəd etdi.* Mir Cəlal. [Müəllim] [Tapdığa] *bir qutu rəngli karandaş gətirmişdi.* Ə.Vəliyev.

3. Rəng bildirən sifətlərdən sonra gələrək əşyanın həmin rəngdə olduğunu bildirir. *Qırmızı rəngli bayraq. Qara rəngli parça. – Yadıma yurdumun çölü, çəməni; Suyu zümrüd rəngli göllərim gəlir!* M.Dilbazi.

**RƏNG-RƏNG** b a x **rəngarəng, rəngbərəng**. *Əriklər, gilaslar sayrışdı rəng-rəng; Ağır şaftalılar yerə baş əydi.* S.Vurğun.

**RƏNGSAZ** *is.* [*fars.*] Divara, tavana və s.-yə rəng çəkməyi özünə peşə etmiş usta; boyaçı. [İkinci işçi:] *Rəngsazlar da orada avara qalıblar, materialları yoxdur*. S.Rəhman. *Bakıda ümumiyyətlə peşəkarlar: bənna, xarrat, dəmirçi, rəngsaz, malakeş və sairə çox olardı.* H.Sarabski.

**RƏNGSAZXANA** *is.* [*fars.*] Rəngsaz emalatxanası.

**RƏNGSAZLIQ** *is.* Divara, tavana və s.-yə rəng çəkən ustanın sənəti, işi, peşəsi; boyaçılıq. [Mahmud Sevincə:] *Mən əvvəllər elə bilirdim ki, rəngsazlıq adi bir fəhləlikdir*. Z.Xəlil.

**RƏNGSİZ** *sif.* 1. Rəngi getmiş, rəngi solmuş; ağarmış, bozarmış. *Rəngsiz jaket. Rəngsiz paltar*.

2. Rəng çəkilməmiş, rəng vurulmamış; boyasız. *Rəngsiz pəncərə. – Bir qədər irəlidə hisli-paslı iki kiçik pəncərə arasında alçaq, rəngsiz bir qapı vardı.* A.Şaiq.

3. Heç bir rəngi olmayan; şəffaf. *Distillə edilmiş su rəngsiz və şəffaf olmalıdır*.

**RƏNGSİZLƏŞDİRMƏ** "Rəngsizləşdirmək"dən *f.is.*

**RƏNGSİZLƏŞDİRMƏK** *f.* Rəngsiz etmək, rəngini aparmaq; ağartmaq, bozartmaq. *Günəş paltarı rəngsizləşdirdi.*

**RƏNGSİZLƏŞMƏ** "Rəngsizləşmək"dən *f.is.*

**RƏNGSİZLƏŞMƏK** *f.* Rəngi getmək, rəngini itirmək, ağarmaq, bozarmaq. *Usta, Hidayətin bozarıb rəngsizləşmiş* (f.sif.) *üzünə qanlı-qanlı baxdı*. B.Bayramov.

**RƏSƏDXANA** [*ər.* rəsəd və *fars.* ...xanə] Astronomik, meteoroloji və s. müşahidələr aparmaq üçün optik cihaz və alətlərlə təchiz olunmuş bina; habelə belə tədqiqatlar aparılan müəssisə. *Şamaxı astrofizika rəsədxanası.*

**RƏSM** *is.* [*ər.*] 1. Kağız, kətan və s. üzərində boya, qələm və s. ilə çəkilmiş hər hansı bir şeyin təsviri; şəkil. *Təbiət rəsmləri. Dəniz rəsmi. Rəsm dəftəri.* ☐ **Rəsm etmək** – çəkmək (şəkil və s.). *Naxışları rəsm etmək.* **Rəsmini almaq** – şəklini çəkmək, surətini çıxartmaq.

2. *köhn.* Ayin, dəb, adət, mərasim, üsul. *Rəsm və təarifdən sonra ona qəlyan gətirdilər.* M.S.Ordubadi. *Barışdırmaq rəsmini tamam edəndən sonra qonaqlar şüru elədilər çay içməyə*. Ə.Haqverdiyev. // *köhn*. Adət, qayda. *Canım aldın, alma peykanın dilisuzandan; Rəsmdir kim, şahlar viranədən almaz xərac*. S.Ə.Şirvani.

**RƏSMÇİ** *is.* Rəssam. [Səlimin] *gözəl rəsmçi olduğunu hamı bildi*. İ.Musabəyov.

**RƏSMƏN** *zərf* [*ər.*] 1. Rəsmi olaraq, rəsmi surətdə. *Azərbaycan Ali Soveti Rəyasət Heyətinin fərmanı ilə* [Mingəçevirə] *rəsmən şəhər adı verilmişdi*. Ə.Sadıq. *Ədhəm Kərəmzadə vəzifəni rəsmən qəbul etdi*. B.Bayramov.

2. *məc.* Zahirən, zahiri olaraq, rəsmiyyət xatirinə. *Özünü rəsmən mədəni göstərmək*.

**RƏSMXƏT** *is.* [*ər.*] Cizgi çəkmə fənni, cizgi dərsi.

**RƏSMİ** *sif.* və *zərf* [*ər.*] 1. Hökumət, müdiriyyət, vəzifəli şəxs tərəfindən və ya adından olan. *Rəsmi sənəd. Rəsmi şəxs. Rəsmi danışıq. Rəsmi məlumat. – Rəsmi təftiş qırğı kimi* [Balacayevin] *üstünü almış*(*dı*). S.Rəhimov. [Hümmət Yusifə:] *Gərək hökumətin rəsmi icazəsini alaq*. B.Bayramov. // Hökumət sənədlərinə xas olan. *Rəsmi dil. Rəsmi terminologiya.*

2. Bütün qaydaları, rəsmiyyəti gözləyərək. *Rəsmi dəvət etmək. Rəsmi hərəkət etmək. Rəsmi icazə almaq. – Əvvəlcə soyuq halda başlanan, rəsmi şəkil alan söhbət get-gedə qızışdı və otağın istiliyinə qarışdı.* Ə.Vəliyev. // *məc*. Soyuq, lakin nəzakətli; soyuqqanlı. *Rəsmi ton. Rəsmi dildə danışmaq. – Qiyasəddinov tam rəsmi bir ahənglə haqq-hesab verirmiş kimi cavab verdi*. S.Rəhimov. *Gəldiyev danışanın Səttarzadə olduğunu bilib, sözünə daha rəsmi bir ifadə vermişdi.* Mir Cəlal.

**RƏSMİLƏŞDİRİLMƏ** "Rəsmiləşdirilmək"dən *f.is.*

**RƏSMİLƏŞDİRİLMƏK** *məch.* Rəsmi şəklə salınmaq; qanuniləşdirilmək.

**RƏSMİLƏŞDİRMƏ** "Rəsmiləşdirmək"dən *f.is.*

**RƏSMİLƏŞDİRMƏK** *f.* Hər hansı bir işə rəsmi şəkil vermək, qanuni şəklə salmaq. *İşi rəsmiləşdirmək.*

**RƏSMİLƏŞMƏ** "Rəsmiləşmək"dən *f.is.*

**RƏSMİLƏŞMƏK** *f.* Rəsmi səciyyə almaq, rəsmi şəkil almaq; qanuniləşmək. *Məsələ rəsmiləşdi.*

**RƏSMİLİK** bax **rəsmiyyət**. *Firəngizin səsində və ifadələrindəki qeyri-adi rəsmilik bir daha* [Muxtarı] *silkələdi*. B.Bayramov.

**RƏSMİYYƏT** *is.* [*ər.*] Bir iş yerinə yetirildiyi zaman tələb olunan şərtlər, qayda və üsullar; bir işin rəsmi cəhəti. *Mirzənin dəfnindən sonra neçə gün xalq oğlanlarının yanına sər-salamətliyə gəlib-getdilər. Bu gəlib-getməklik rəsmiyyət idi.* Ə.Haqverdiyev. [Qəhrəman:] *Yusif! Rica edirəm, rəsmiyyəti hələlik bir tərəfə buraxaq və səmimi danışaq.* Ə.Vəliyev. ☐ **Rəsmiyyətə salmaq** – rəsmi qayda-qanuna uyğunlaşdırmaq, rəsmi etmək, rəsmi xarakter vermək. *Rusiya hökuməti üçün belə bir vəsiqə düzəltmək və Təbrizin işğalını rəsmiyyətə salmaq lazımdı.* M.S.Ordubadi. *Onu özümüz də yazıb rəsmiyyətə salarıq.* Mir Cəlal.

**rəsmiyyətlə** *zərf* Rəsmi olaraq, rəsmi şəkildə. *Eldar rəsmiyyətlə onları* [öz arvadı ilə Ceyranı] *tanış edir*. S.Hüseyn.

**RƏSMİYYƏTÇİLİK** *is.* İşin əsil mahiyyəti zərərinə olaraq onun rəsmi (zahiri) cəhətinə həddindən artıq fikir vermə, bir şeyə qarşı ifrat dərəcədə rəsmi münasibət. *Rəsmiyyətçilik etmək.*

**RƏSM-KEÇİD** bax **parad**.

**RƏSMLİ** *sif.* Rəsm çəkilmiş, rəsm verilmiş, rəsmi olan; şəkilli. *Rəsmli kitab. Rəsmli jurnal.*

**RƏSSAM** *is.* [*ər.*] Təsviri incəsənət sahəsində yaradıcı işçi; rəsm çəkən sənətkar. *Mənzərə rəssamı. – Rəssamın fırçası yorulmadan işlərdi.* İ.Əfəndiyev.

**RƏSSAMLIQ** *is.* Rəssam sənəti, rəssam peşəsi. *Rəssamlıq etmək.* – // Rəssamın işi ilə bağlı olan. *Rəssamlıq salonu. Rəssamlıq sərgisi.*

**RƏSUL** *is.* [*ər.*] 1. *köhn*. Elçi, səfir.

2. Peyğəmbər, nəbi. *Allahın rəsulu. – ..Elə zənn etdilər ki, bu əlamət rəsuli-Xudanın müsibətinə səbəb vaqe oldu.* A.Ə.Axundzadə.

**RƏŞADƏT** *is.* [*ər.*] İgidlik, qoçaqlıq, qəhrəmanlıq. *Döyüş rəşadəti. Əmək rəşadəti. Əsgərlərin rəşadəti. – Ələsgər ağanın bu rəşadəti usta Ağabalanın yadından heç çıxmazdı*. Çəmənzəminli.

**RƏŞADƏTLİ** *sif.* İgid, qoçaq. *Rəşadətli ordu.*

**RƏŞƏ** *is.* [*ər.*] Titrəmə, titrəyiş, əsmə. *Atlı kəndin kənarına çatdıqda Tellinin vücudunu bir rəşə aldı*. S.Hüseyn. *Birdən rəssamın dodaqları rəşə ilə titrədi*. İ.Əfəndiyev.

**RƏŞİD** *is.* [*ər.*] İgid, qoçaq, qəhrəman, rəşadətli. [Heydər bəy:] *Heç kəs qorxudan gedib* [qaçaq mal] *gətirə bilmir, məgər handa bir rəşid və qoçaq adam cürət edib bir yük, iki yük çıxarda bilər*. M.F.Axundzadə. *Qabaqkı arvadı da rəşid idi, indiki arvadı da qoçaqdır.* Ə.Vəliyev.

**RƏŞİDLİK** *is*. Qoçaqlıq, igidlik, qorxmazlıq, rəşadət. [Əsgər bəy:] *Biz ki* [Hacı Qaranın] *rəşidliyini danmırıq.* M.F.Axundzadə.

**RƏŞQ** *is.* [*ər.*] *köhn*. 1. İncə, nazik.

2. Hər şeydən mütəəssir olan, həssas.

**RƏŞMƏ** *is.* Lent. *Bizim ağ rəşmə kimi burularaq gedən yollar xeyli uzaqlara qədər iki tərəfdən uca ağaclarla əhatə olunmuşdur.* Mir Cəlal.

**RƏVA** *is.* [*fars.*] 1. Caiz, layiq, münasib. ☐ **Rəva bilmək (görmək)** – məsləhət bilmək (görmək), caiz bilmək, layiq bilmək (gör-

mək). [Pəri xanım:] *Bəs bu axır ömrümdə, sən rəva görürsən ki, mən Şölə xanımın qucağında oğul görməyib ölüm?* M.F.Axundzadə. [Baftai Pərşana:] *Siz gərək rəva görməyəsiniz ki, Azər tapılmadığı üçün sərhəng Ehtişami məni baş vəzirin qəzəbinə qurban verə!* Ə.Məmmədxanlı.

2. **Rəvadırmı** və ya **rəvamıdır** şəklində – məsləhətdirmi, layiqdirmi, caizdirmi. [Qərib:] *Rəvamıdır Qərib burda gözləyə.* "Aşıq Qərib". [Yusif:] *Gör heç rəvadırmı ki, illər ilə bəslədiyin gözəl fikirlər bir dəqiqədə puç ola*. N.Nərimanov.

**RƏVAC** *sif.* [*ər.*] Müştərisi çox olan; tezsatılan, çoxişlənən, işəgedən. [Hacı Qara:] *Zalım oğlu zalım, yüz yol Qurana, peyğəmbərə and içdi ki, çox rəvac maldır.* M.F.Axundzadə.

◊ **Rəvac tapmaq** – irəli getmək, tərəqqi etmək, inkişaf etmək, irəliləmək. *Vahidin işi günü-gündən rəvac tapırdı*. Mir Cəlal. **Rəvac vermək** – irəli aparmaq, tərəqqi etdirmək, inkişaf etdirmək; irəlilətmək. *Şərq musiqisinin yollarını müsbət bir surətdə təyin etmək və o yollar üzərində musiqimizin tərəqqisinə rəvac vermək üçün çoxdan bəri bir musiqi məktəbinə ehtiyac var idi.* Ü.Hacıbəyov.

**RƏVAN** *sif.* və *zərf* [*fars.*] Axıcı, səlis, aydın, asan oxunula və başa düşünülə bilən tərzdə. *Xəyal etmişdi Vaqif kim, rəvan bir xoş qəzəl yazsın.* M.P.Vaqif. // Oxunaqlı, aydın, səlis, aydın başa düşülən. *Rəvan yazı. Əsərin dili rəvandır. Roman rəvan oxunur.*

◊ **Yoluna (yolu ilə) rəvan olmaq** – yola düşmək, getmək. *Qız cavab verməyib, atılıb qaçdı, Məşədi Qasım da yolu ilə rəvan oldu.* Çəmənzəminli. *Çəkirdi yaylıma sürünü çoban; Olurdu qaçaqlar yoluna rəvan*. H.K.Sanılı.

**RƏVANLIQ** 1. *is.* Aydınlıq, səlislik, oxunaqlılıq. *Yazının rəvanlığı. Romanın dilinin rəvanlığı*.

2. **Rəvanlıqla** şəklində – rəvan surətdə; səlis, aydın. [Bəhlul:] *Direktor hərdən mənə baxırdı, natiqlərə məxsus rəvanlıqla danışırdı.* B.Bayramov.

**RƏVAYƏT** *is.* [*ər.*] Bir hadisə, əhvalat və s. haqqında qısa nağıl; hekayət. *İmamlar haqqında rəvayətlər. – Qulaq as, duzlu bir hekayətdir; Məzəli, gülməli rəvayətdir*. Ə.Qəmküsar. □ **Rəvayət etmək** – demək, danışmaq, nəql etmək. *Ağıçı arvadlara mərhumun səxavət və kəramətindən rəvayət etmədə idi.* Çəmənzəminli. **Rəvayətə görə** – deyildiyinə görə, danışıldığına görə. [Qudyal çayı] *qədim bir çaydır və rəvayətə görə Quba şəhəri vaxtilə bu adla adlanmışdır.* Ə.Sadıq. *Rəvayətə görə niysan ayında olan belə yağışlı günlərdə balıqqulağı su üzünə çıxıb ağzını açır.* S.Vəliyev.

**RƏY** *is.* [*ər.*] 1. Bir şey haqqında fikir, mülahizə, söz. *Bu barədə rəyin nədir?* – [Katib] *ərizəmi oxudu. Üzvlərin rəyini soruşdu.* M.Hüseyn.

2. Bir əsər, tamaşa, konsert, kinofilm və s.-nin təhlil və tənqidini ehtiva edən məqalə, yazı; resenziya. *Əsər haqqında rəy yazmaq. Rəsmi opponentlərin rəyi.*

3. Fikir, mülahizə. *Fərəc xan Bağır xanın əmisi oğlu və damadıdır, heç bir əmrdə onun rəyinə müxalifət etməz*. M.F.Axundzadə. *Xanın rəyi Vaqif vasitəsilə Kazım kişiyə bildirildi*. Çəmənzəminli.

4. **Rəyimcə, rəyincə** şəklində – 1) məncə, səncə, mənə görə, sənə görə, ona görə. *Rəyimcə pis roman deyil;* 2) mən (sən, o) istəyən kimi, mənim arzumca; sənin arzunca, onun arzusuna görə. *Bu nə keyfiyyətdir, bu nə macəra; Rəyimcə dolanmaz təqdiri-qəza.* Q.Zakir. [Əxsitan:] *Rəyimcə dönməyir bu çərxi-dövran; Bəlkə susar bir az nankor əhali.* M.Rahim.

◊ **Rəy vermək, rəyə gəlmək** – razılaşmaq. [Xudayar bəy Vəliquluya:] *Sən istəsən, anan əlüstü rəyə gələr*. C.Məmmədquluzadə. **Bir rəyə gəlmək** – müəyyən bir fikrə, nəticəyə gəlmək; razılaşmaq, sazişə gəlmək. *Haqsız qanlar axmasın deyə; Səyavuşla Piran gəldi bir rəyə.* H.Cavid. *Nəhayət, komissiya üzvlərinin hamısı bir rəyə gəldi*. M.Hüseyn.

**RƏYASƏT** *is.* [*ər.*] Rəislik, başçılıq, rəhbərlik. *Vəliəhdin rəyasəti altında çağırılan hərbi müşavirə gecə saat 12-də qurtardı.* M.S.Ordubadi. □ **Rəyasət heyəti** – iclas və ya müşavirənin seçilən rəhbər orqanı. *Rəyasət heyəti seçmək. – Mehman rəyasət heyəti içərisində oturmuşdu.* S.Rəhimov. // Bəzi

idarə və təşkilatların seçilən rəhbər orqanı. *Azərbaycan Elmlər Akademiyasının Rəyasət Heyəti;* // həmin orqana daxil olan adamlar. *Rəyasət heyətinin təklifi.*

**RƏYÇİ** *is.* Rəy (2-ci mənada) yazan adam, rəy müəllifi. *Elmi əsərin rəyçisi.*

**RƏZALƏT** *is.* [*ər.*] Alçaqlıq, əclaflıq, alçaq iş. [Xaqani:] *Bir yanda toy-büsat, bir yanda matəm; Şah qız oğurladır, rəzalətə bax!..* M.Rahim. *Fürsət düşərsə bu qorxaq adam Bülənd haqqında heç bir rəzalətdən geri durmayacaqdı.* Ə.Əbülhəsən.

**RƏZƏ** *is. dan.* Cəftə. *Rəzəni bağlamaq. – Qəsrin qalın taxta qapısı rəzəsindən qopub ayaq altına düşmüşdü.* M.Rzaquluzadə. *Ağca xanım qapının rəzəsini vurdu.* Mir Cəlal.

**RƏZƏLİ** *sif.* Rəzəsi olan; cəftəli. *Rəzəli qapı. – Rəzəli sandıqdakı boğçaların hərəsi bir ömrə bəs edərdi.* Mir Cəlal.

**RƏZİL** *sif.* [*ər.*] Alçaq, şərəfsiz. *Rəzil adam. – Rəzil düşmən yaralanmış, yırtıcı bir canavardır.* S.Vurğun. // İs. mənasında. [Gülnaz:] *Onu da deyim ki, elə rəzillər mənim namusuma ləkə vura bilməzlər.* Q.İlkin. ◻ **Rəzil etmək** – alçaltmaq, şərəfsiz etmək. *Bu vaxta qədər kimsə qarovulçunun qarşısına çıxmamış və onu belə rəzil və təhqir etməmişdi.* A.Şaiq. **Rəzil olmaq** – rüsvay olmaq, biabır olmaq, alçalmaq. *Yaşama dünyada, olma gəl rəzil; İnsansan, unutma, öz qədrini bil!* H.K.Sanılı.

**RƏZİLLİK** *is.* Alçaqlıq, şərəfsizlik.

**RISA** *is.* İpə, sapa düzülmüş hər hansı bir şey. *Nar rısası. Alana rısası. – Bu kişi şəhər küçələrindən birində oturub, halqa qoğallar satardı. Qolundan və boynundan asdığı qoğal rısaları onu çörək ağacına bənzədirdi.* M.Arif.

**RISALAMA** "Rısalamaq"dan *f.is.*

**RISALAMAQ** *f.* İpə düzmək, sapa düzmək. *Qoğalı rısalamaq.*

**RİAL** *is.* [*fars.*] İranda pul vahidi.

**RİAYƏT** *is.* [*ər.*]: **riayət etmək** – gözləmək, əməl etmək. *Ehtimal, həkim öz yerişində hifzüssəhhə qaydalarına riayət etmək istəyirdi.* Mir Cəlal. *Hüseyn dərhal edir əmrə riayət; Şığıyır bayıra, meydana gedir.* M.Rahim.

**RİAYƏTSİZLİK** *is.* Hörmətsizlik, sayğısızlıq, riayət etməmə.

**RİCA** *is.* [*ər.*] Birinə müraciət edərək bir işin yerinə yetirilməsini arzu etmə, istəmə; xahiş. *Ricasını yerinə yetirmək. – Min göz ilə ağlasın aləm gərək əhvalıma; Çünki əğyarın ricasilə məni yar öldürər.* Heyran xanım. [Xədicənin] *ricasını yerə salmaq istəmirdim.* S.Hüseyn. ◻ **Rica etmək (eləmək)** – xahiş etmək, yalvarmaq. *Sonra hamı rica etdi ki, bu oyunu* [Qaraca qız] *bir də təkrar etsin.* S.S.Axundov. *Uşaqlardan biri .. həsrətlə baxdığımı görüb, anamdan mənim də onlarla iştirak etməyimi rica etdi.* T.Ş.Simurq.

**RİCƏT** *is.* [*ər.*] 1. Geriyə dönmə, qayıtma, gəldiyi yerə tərəf hərəkət; əvvəlki yerə qayıtma; geri çəkilmə. *..Siyasi mübarizədə yeni qüvvələr toplamaq üçün müvəqqəti ricət ən ağıllı bir üsuldur.* M.S.Ordubadi. [Qoca:] *Assuriya, Midiya, Elam və iskitləri titrədən ordu parslar tərəfindən ricətə sövq edildi.* Çəmənzəminli. ◻ **Ricət etmək** – geriyə dönmək, qayıtmaq; geri çəkilmək. *Fədailər diliranə ricət etdi dübarə; Şahpərəstlər şikəs tapıb, üz qoydular fərarə.* A.Səhhət.

2. Dini etiqadlara görə qiyamət günü dirilib təzədən məhşərə qayıtma. *Hər kəs ölənlərin ricətini, yəni dirilib bu dünyaya gəlməyini xahiş edir.* C.Məmmədquluzadə.

3. *məc.* Haşiyə çıxma, mətləbdən kənar çıxma. *Əsərdə ritorik təsvirlər, ricətlər və uzunçuluq yoxdur.* M.İbrahimov.

**RİÇAL** *is.* Doşabda bişirilən üzüm, əncir, tut və b. meyvələrin mürəbbəsi. *Yemiş riçalı. Üzüm riçalı. – Baba əncirin yarıdəymişindən tabaqlara dərib nənəyə verərdi, nənə də alıb riçal bişirərdi.* H.Sarabski. *Xanpəri kərə yağla tut riçalı gətirib stolun üstünə qoydu.* Ə.Vəliyev.

**RİDİKÜL** *is.* Qadın əl çantası.

**RİFAH** *is.* [*ər.*] Yaşayışda xoş güzəran, firavanlıq, bolluq və rahatlıq. *Xalqın rifahına çalışmaq.*

**RİKOŞET** *is.* 1. Səkdirmə.

2. Uçan cismin dəyib yana sıçraması.

**RİKŞA** [*yapon.*] Şərqi və Cənubi Asiyanın bəzi ölkələrində, həmçinin Cənubi Afrika İttifaqında: kiçik ikitəkərli arabaya qoşulub minik və yük aparan adam. *Söz yox ki, sənaye inkişaf etdikcə, əhali işlə təmin olunduqda rikşanın müasirləşmiş forması olan bu nəqliyyat vasitəsi də götürüləcəkdir.* M.İb-

rahimov. *Gördün yazıq rikşaları; Ağalar sürür heyvan kimi.* M.Rahim.

**RİQQƏT** *is.* [*ər.*] Ürək yumşaqlığı, ürək incəliyi, şəfqət. *İlk dəfə idi ki, Sadıq kişi oğlunun, əziz-xələf oğlunun səsindəki həzin riqqəti görüb duyur, ürəyinin başı ağrıyırdı.* Mir Cəlal. // Təsirlənmə, mütəəssir olma, acıma; təəssür. *..Tələbələrin səhnədə göstərdikləri müvəffəqiyyəti gördükcə riqqət və sevincindən gözləri yaşlar içində qalırdı.* A.Şaiq. *Toplaşanlardan çoxunun gözü həyəcan və riqqətdən yaşarmışdı.* R.Rza. ◻ **Riqqətə gəlmək** – b a x **riqqətlənmək**. *Anasının mehribanlığından riqqətə gəlmiş və ürəyi açılmış Qaraş gülümsədi.* M.İbrahimov. *Bu söhbətdən sonra Ulduz riqqətə gəlmiş, artıq anasının könlünü sındırmayaraq o tibb institutuna daxil olmuşdu.* Ə.Məmmədxanlı. **Riqqətə gətirmək** – b a x **riqqətləndirmək**. *Axund Fərəc, vəhşi adlandırdığı bu .. xalqı ağladacaq, riqqətə gətirəcək və sonra bütün acığını çıxacağını zənn edirdi.* Qantəmir.

**RİQQƏTLƏNDİRMƏ** "Riqqətləndirmək"dən *f.is.*

**RİQQƏTLƏNDİRMƏK** *f.* Riqqətə gətirmək, mütəəssir etmək, təsirləndirmək, ürəyini nazikləşdirmək.

**RİQQƏTLƏNMƏ** "Riqqətlənmək"dən *f.is.*

**RİQQƏTLƏNMƏK** *f.* Riqqətə gəlmək, mütəəssir olmaq, təsirlənmək, ürəyi nazikləşmək. *..İnsan seyr etdikcə qəlbi riqqətlənib, ruhu ucalıb özündə bir ülviyyət, bir əzəmət hiss etməyə məcbur* [olurdu] C.Məmmədquluzadə. *Sonralar Rəhimovun 80 yaşlı atası da "oğlumu sizə tapşırıram", – deyib riqqətləndi.* R.Rza.

**RİQQƏTLİ** *sif.* Rəhm və şəfqət ifadə edən; rəhmi, şəfqəti olan; canıyanan, ürəyiyuxa. *Riqqətli ürəyi var. Riqqətli ana qəlbi.* // Təsirli, təsirləndirici; mərhəmət doğuran, acınacaqlı. *Məsmənin səsi sakit, riqqətli, lakin qəti və kəsərli idi.* Mir Cəlal.

**RİND** *is.* [*ər.*] *klas.* Vaxtını eyş-işrətlə keçirən laqeyd, laübalı adam; xərabati. *Rindlər bəzmin gəzib bir-bir yetir məndən niyaz.* Füzuli. *Badə zövqün nə bilir rindi-kühəndən qeyri!* Ə.Vahid.

**RİNQ** *idm.* [*ing.*] Ətrafı kanatla tutulmuş boks yarışı meydançası.

**RİSALƏ** *is.* [*ər.*] 1. Məktub, namə, kağız. *Ey əziz, yaxşı can, min dərdə dərman; Yazdığın risalə nə yaxşı-yaxşı.* Aşıq Ələsgər. [Fərrux:] [Mollanın] *müctəhiddən risaləsi, qazıdan icazəsi var.* Ə.Vəliyev.

2. Hər hansı bir məsələyə dair kiçik kitab; kitabça. // Jurnal, məcmuə. [Bax Nemətə:] *Sizin ilk işiniz şəhəri dolanıb, bu risalə üçün elan toplamaqdır.* Çəmənzəminli.

**RİSK** [*fr.*] Təhlükə imkanı, ola biləcək təhlükə, qorxulu iş. // Yaxşı nəticələnəcəyi ümidi ilə hərəkət etmə, iş görmə, cəsarət etmə, təvəkkülü iş (görmə). *Azca sonra maşın hərəkət edib Şimran yoluna düşdü. Firidun ancaq indi ağır bir riskə yol verdiyinin fərqinə vardı.* M.İbrahimov. ◻ **Risk etmək (eləmək)** – nə kimi nəticə verə biləcəyini göz önünə almadan hərəkət etmək, bir işə iqdam etmək, qorxmayaraq hərəkət etmək; özünü təhlükə altına atmaq. *Cəhənnəmə olsun, necə olur olsun, risk eləmək lazımdır.* S.Rəhman.

**RİŞ** *is.* [*fars.*] *klas.* Saqqal. *Vəqta ki, qocaldın; Rişi döşə saldın; Pis günlərə qaldın; Onda biləcəksən!* M.Ə.Sabir. *Maşallah, bu deyil riş ki, mərcandır bu!* Ə.Nəzmi.

**RİŞBABA** *is.* Uzunsov iri giləiləri olan üzüm növü. *Rişbaba, həzarı, qaraşirə üzümü bütün Qarabağda məşhurdur.* Ə.Vəliyev.

**RİŞƏ** *is.* [*fars.*] Kök (bitkidə). *Yazın bir ayında xoş keçər illər; Zoğ edib rişədən baş verər güllər.* Aşıq Ələsgər. *Göy otlar qaranlıq torpağın altından başlarını çıxarıb, yüksəlmək üçün bahar havasından rişələrinə qüvvət diləyirdilər.* Ə.Haqverdiyev. ◻ **Rişə atmaq (salmaq)** – kök atmaq, kök salmaq, rişələnmək. *Çadır qarşılarında yanan məşəllərin şəfəqləri Araz çayının dalğalarına rişə atırdı.* M.S.Ordubadi. *Eşqin bu könlümdə atmış rişələr; Əcəlsə qoymadı versin bir səmər.* A.Şaiq. [Sultan bəydə] *şübhələnmək .. özünə məxsus rişə salmışdı.* S.Rəhimov.

**RİŞƏSİZ** *sif.* Köksüz.

**RİŞXƏND** *is.* 1. Ələ salma, lağa qoyma, istehza etmə; masqara. *Salavat bu açıq rişxəndi başa düşdü.* Ə.Əbülhəsən. ◻ **Rişxənd etmək (eləmək)** – ələ salmaq, istehza etmək, lağa qoymaq. *Kosaya rişxənd edənin top qara saqqalı gərək.* (Ata, sözü). [Ələsgər:]

*Qardaş, sən mənim çərçi olmağıma rişxənd eləyirsən?* Ə.Haqverdiyev. **Rişxəndə qoymaq** – bax **rişxənd etmək (eləmək)**. *Hər pirləri rişxəndə qoyub məsxərə qılma!* Ə.Qəmküsar. *Zeynal həm də türkcə danışaraq, Ağasəfəri rişxəndə qoyurdu..* Ə.Əbülhəsən. **Rişxəndə salmaq** – rişxənd üçün hədəf etmək.

2. "ilə" qoşması ilə – ələ salaraq, masqara ilə, istehza ilə; rişxəndlə. *Rişxənd ilə cavab vermək.* – [İmran:] *Sizdən rica edirəm ki, mənlə rişxənd ilə danışmayasınız.* S.S.Axundov. [Gülsabah Mirzə Camala:] *Siz bu sözləri mənə rişxənd ilə deyirsiniz?* C.Cabbarlı.

**RİŞXƏNDCİL** *sif.* Rişxənd etməyi adət etmiş rişxənd etməyi sevən, adamı lağa qoyan. *Rişxəndcil adam.*

**RİŞXƏNDÇİ** *is.* Hər şeyə rişxənd edən, adamı ələ salan; adamoynadan, masqaraçı, istehzaçı.

**RİŞXƏNDEDİCİ** bax **rişxəndli**. [Ev sahibi] *rişxəndedici bir sima ilə: – Rüstəm bəy, şəkil barəsində mənim zövcəmlə danışmayın.* Çəmənzəminli.

**RİŞXƏNDLƏ** bax **rişxənd** 2-ci mənada. *Şahin birdən qəhqəhə çəkdi, rişxəndlə əlini tovladı..* V.Şıxlı. *Həmzə gözlərini dolandırıb, Şahmara tərs-tərs baxdı, rişxəndlə gülümsündü.* B.Bayramov.

**RİŞXƏNDLİ** *sif.* Rişxənd bildirən, rişxənd ifadə edən; istehzalı. *Rişxəndli gülüş.* – *Səməd həmişə Rüstəmin ibadətinə rişxəndli bir təbəssümlə tamaşa edərdi.* Çəmənzəminli. [Qəhrəmanın] *qulağı hələ rişxəndli sözlər eşidirdi.* S.Rəhimov.

**RİŞXƏNDYANA** bax **rişxəndli**. *Rişxəndyana gülmək. – Burada Maralın solğun çöhrəsindən rişxəndyana bir təbəssüm keçdi.* Ə.Əbülhəsən. *Fərraşlardan biri rişxəndyana dedi: – Ağa, əllicə tümən.* P.Makulu.

**RİŞTƏ** *is.* [*fars.*] *klas.* 1. Əriştə. *İki batman riştə kəssə on nəfər övrət yığar; Zəhrimar olsun həmi riştən, həmi yarman, bacı.* M.Möcüz.

2. *məc.* Tel, bağ, rabitə. [Vaqif, Vidadi, Zakir və Şirvaninin] *qələmlərindən hər nə zühurə gəlibsə, demək olar ki, can riştəsi ilə və ürək qanı ilə təhrir və tənzim olunubdur.* F.Köçərli.

**riştə-riştə** *zərf* Nazik-nazik, əriştə kimi. [Murad:] *Doğrayın məni riştə-riştə.* H.Cavid.

**RİTM** [*yun.*] 1. Bir şeyin (hərəkətin) bu və ya başqa şəkildə növbələnməsi; müntəzəmlik.

2. Səs, nitq və s. ünsürlərinin təkrarlanmasında müəyyən ardıcıllıq; ahəng, vəzn. *Musiqinin ritmi. – Şerin ritmində Koroğluya xas olan bir dotələblik vardır.* M.Hüseyn.

**RİTMİK** *sif.* [*yun.*] Ritmə tabe olan, müəyyən ritmlə ifa edilən; ahəngli, vəznli, müntəzəm. *Ritmik hərəkət. Ritmik muğam. – Azərbaycan xalq musiqisi öz metro-ritmik quruluşuna görə iki yerə bölünür.* Ü.Hacıbəyov. *Bəlkə, elə burdan gəlir; Muğamların ilk rəngləri; Təsnifləri, ritmləri..* B.Vahabzadə.

**RİTMİKA** [*yun.*] 1. Ritmin sistem və xüsusiyyəti. *Musiqinin ritmikası.*

2. Ritm haqqında elm.

3. Ritm duyğusu aşılamaq məqsədilə edilən bədən hərəkətləri sistemi.

**RİTORİK** *sif.* [*yun.*] Ritorika qaydalarına əsaslanan. // *məc.* Təmtəraqlı, dəbdəbəli. *Ritorik təsvir. – C.Cabbarlının əsərlərindəki ictimai fikir daha da dərinləşir, aktual mövzu şüarçılığa çevrilmir, ritorik şəklə düşüb adamı yormurdu.* M.İbrahimov. [Səməd Vurğun] *özündən əvvəl oxunan ritorik bir şerə işarə edərək nitqini təhlili sual ilə başladı.* Mir Cəlal.

**RİTÓRİKA** [*yun.*] Natiqlik nəzəriyyəsi, natiqlik sənəti haqqında elm; bəlağət elmi, bəyan. // *məc.* Qəliz, ibarəli, təmtəraqlı üslub. *Ritorikaya qapılmaq.*

**RİVANÓL** *is.* [*lat.*] Antimikrob təsirli dərman preparatı.

**RİYA** *is.* [*ər.*] İkiüzlülük. *Məsciddə həsiri eləmə aləti-təzvir; Mərdanə qədəh tut, bu riyadən dəxi ar et.* S.Ə.Şirvani. *Ana ürəyi* [yasavulbaşının] *gözlərindəki saxta boyanı, sözlərindəki hiylə və riyanı duydu.* M.Rzaquluzadə.

**RİYAKAR** *sif.* [*ər.* riya və *fars.* ...kar] İkiüzlü. *Lakin vətən və xalq düşməni olan riyakar xanlar xəyanət yolu ilə Nadirə mane olurlar.* M.Arif. *Mirzə Mehdi riyakar bir əda ilə sözə başladı.* A.Şaiq. // İs. mənasında. *Mən hara, qaraya ağ demək hara? Mən ki düşmən idim riyakarlara.* B.Vahabzadə.

**RİYAKARCASINA** *zərf* Riyakarlıqla, ikiüzlülüklə. *Riyakarcasına hərəkət etmək. – Fərman riyakarcasına güldü.* M.İbrahimov.

**RİYAKARLIQ** *is.* İkiüzlülük. *Çökür abidəsi qanlı çarlığın; Çökür məhkəməsi riyakarlığın.* M.Müşfiq. ◻ **Riyakarlıq etmək (eləmək)** – ikiüzlülük etmək. [Dürrə] *bilirdi ki, adaxlısı .. riyakarlıq etməyən təmiz və namuslu adamdır.* S.Vəliyev.

**RİYASIZ** *sif.* Təmiz qəlblə edilən (olan, görülən), içində heç bir riya olmayan; təmiz, saf. // Təsirli, təsirləndirici; mərhəmət doğuran, acınacaqlı. [Şeyx Sədra:] *Onların baxmayıb da zahirinə; Bax riyasız, təmiz ürəklərinə.* H.Cavid. *Qız eyni duru və riyasız gözlərini ani olaraq* [Xavərin] *gözlərinə dikdi və çəkdi.* M.İbrahimov.

**RİYAZƏT** *is.* [*ər.*] *din.* Allahdan qorxaraq, özünü dünya nemət və ləzzətlərindən məhrum edib zahidliyə qapılma. *Adətim hər zaman riyazətdir; Bütün insanlara məhəbbətdir.* A.Şaiq.

**RİYAZİ** *sif.* [*ər.*] Riyaziyyata aid olan, riyaziyyatla bağlı olan. *Riyazi düstur. – Lalə son vaxtlarda qızının dərslərini yoxlamağa, çətin riyazi məsələlərin həllində ona kömək eləməyə daha çox imkan tapırdı.* M.Hüseyn.

**RİYAZİYYAT** *is.* [*ər.*] Kəmiyyət münasibətlərini və obyektiv aləmin mücərrəd formalarını öyrənən elmlərin məcmusu. *Ali riyaziyyat. Elementar riyaziyyat.*

**RİYAZİYYATÇI** *is.* Riyaziyyat mütəxəssisi. [Həsən] *ən güclü riyaziyyatçı idi.* İ.Əfəndiyev.

**RİYAZİYYATŞÜNAS** [*ər.* riyaziyyat və *fars.* ...şünas] b a x **riyaziyyatçı**.

**RİZ** *is.* [*fars.*] *dan.* Cığır, iz. *Böyük gəmiləri, dəmir yolları; Keçidləri, rizləri var ölkəmin.* C.Cabbarlı. *Biçinçilərdən bəzisi açdığı rizi düz apara bilmədiyindən cərgələr hərdən bir-birinə qarışırdı.* Ə.Əbülhəsən.

◊ **Riz itirmək** – b a x **iz itirmək** (“**iz**”də). [Kərbəlayı Rəcəb:] *Ay xanım! Güldəstə özü yaxşı bilir ki, mən nə usta Xəlili tanıyıram və nə də İran əhlindən bir kəsi... Güldəstə riz itirir, vəssalam.* N.Vəzirov.

**RİZA** *is.* [*ər.*] Razılıq. *Soralım hər zaman rizalərini; Alalım xeyirli düalərini.* M.Ə.Sabir. *Üzərimdə olan ləkələri bir qadının riyasını əldə etməklə yox, təzə qanlar ilə təmizləmək mümkündür.* M.S.Ordubadi. ◻ **Riza almaq** – razılıq almaq. [Padşah:] *Səidin övrətindən riza almaq sənin öhdənə tapşırılır.* Ə.Haqverdiyev. **Riza vermək** – razılıq vermək, razı olmaq. [Ağa:] *..Qızının nikahının Fərmana cari olmasına riza verirsənmi?* Ə.Haqverdiyev. // İstək, iradə, ixtiyar. ◻ **Öz rizası ilə** – öz xoşu ilə, öz istəyi ilə, öz razılığı ilə.

◊ **Allah rizasına** – 1) savab üçün, Allah yoluna, Allaha xoş gedər. [Qurban:] *Elə bil Allah rizasına, Allah yoluna verirsən, bir-iki manat verib yola salaydın.* Ə.Haqverdiyev; 2) yalvarış mənasında – Allah xatirinə. [Səriyyə:] *Səfər! Allah rizasına mənə rəhmin gəlsin.* C.Cabbarlı.

**RİZAMƏND** [*ər.* riza və *fars.* ...mənd] *klas.* Razı qalan, razı.

**RİZAMƏNDLİK** *is. klas.* Razılıq. [Mollabaşı:] *Bu xüsusda İran xalqından dəxi kəmali-rizaməndliyim var..* M.F.Axundzadə. *Təbrik göndərənlərə birbəbir xüsusi surətdə məktub ya teleqram ilə rizaməndlik göndərmək bizə mümkün olmadı.* “Mol. Nəsr.”. ◻ **Rizaməndlik almaq** – razılığını almaq. *Şabanın vədəsi tamam oldu. Amma qayıtmağı üçün gərək şəhər əhlindən rizaməndlik alına idi.* Ə.Haqverdiyev. **Rizaməndlik etmək** – razılıq etmək, təşəkkür etmək, razı qaldığını söyləmək. *Hər bir vaxt Mirzə Nəsibi görəndə Ağa Hüseyn rizaməndlik edir.* Ə.Haqverdiyev.

**RİZASIZ** *sif.* Razılığı olmadan edilən, görülən, alınan və s. *Rizasız tikənin ləzzəti olmaz!* (Ata. sözü).

**RİZƏ** *is.* [*fars.*] Tikə, kiçik parça, qırıntı.

**rizə-rizə** *sif.* və *zərf* Parça-parça, tikətikə. *Rizə-rizə etmək.* – [Şah:] *Səni rizə-rizə elətdirərəm.* C.Cabbarlı.

**RİZQ** *is.* [*ər.*] Azuqə, yeyəcək, ruzi. *Rizq artmaz, möhnət artar.* (Ata. sözü). *Arvad məni inandırır ki, bir çox ac itlər və heyvanlar öz rizqlərini zibildə tapırlar, onları doyurmaq da savabdır.* C.Məmmədquluzadə.

**RİZVAN** *is.* [*ər.*] *klas.* 1. İslam əsatirində: cənnətin gözətçisi və qapıçısı olan mələkin adı. *Rizvanlar təzim edib ustanın pak qədəmlərini təbrik etdilər.* Çəmənzəminli.

2. *məc.* Behişt. *Öymə, ey zahid, mənə rizvanü cənnət bağını.* Xətayi. *Evlərin ətri, ənbəri; Bənzəyir rizvana, deyin.* Aşıq Ələsgər.

**RÓBOT** *is.* [*çex.*] İnsana məxsus işləri icra edə bilən avtomat maşın.

**ROK** *is.* [*ing.*] 1. Səs-küylü müasir musiqi növü.

2. Yırğalanma, yellənmə.

**ROKOKÓ** [*fr.*] XVIII əsrdə Fransada meydana gəlib formalarının zərifliyi və mürəkkəbliyi, naxışlarının qəribəliyi ilə fərqlənən memarlıq və bəzək üslubu. *Rokoko üslubunda mebel.*

**ROL** [*fr.*] 1. Artistin səhnədə, kinofilmdə təmsil etdiyi surət. *Molla rolunu oynayan aktyor Sona xalaya sataşmaq məqsədilə .. zarafat etməyə başladı.* S.S.Axundov. // Məc. mənada. *Mahmud öz arvadına evdə lazımınca təlim etmişdi. İndi burada rolunu yaxşı ifa etməyinə şübhələnməyirdi.* B.Talıblı. *Yaxşı saxlaya bilmir öz rolunu yadında; Yanır, tüstüsüz yanır qısqanclığın odunda.* S.Rüstəm.

2. Pyesin, tamaşada iştirak edən hər bir aktyora aid olan mətni. *Rolunu əzbərləmək. Rolunu oxuyub təkrarlamaq.*

3. **Rolunda** şəklinlə – ... sifətilə, bir ... kimi. *Müşahidəçi rolunda iştirak etmək. Vəkil rolunda çıxış etmək.*

◊ **Rol oynamaq** – əhəmiyyəti olmaq, təsiri olmaq, hər hansı bir yolla təsir göstərmək. *Xalq tamaşaları hər bir zaman xalqların həyatında mühüm rol oynamışdır.* Ə.Haqverdiyev. **Rola girmək** – başqa bir vəziyyəti, keyfiyyəti mənimsəmək, götürmək; öz vəzifəsini, vəziyyətini yaxşı mənimsəmək. *Dadaşovun dodaqları qaçdı, ağappaq, sapsağlam dişləri göründü: – Eh, Sabit müəllim, – dedi. – Ömrümdə bircə dəfə rola girmişəm, onu da mənə çox görürsən.* İ.Məlikzadə.

**ROLİK** *is.* [*rus.* əsli *alm.*] 1. Balaca metal diyircək, çarx, təkər (məs.: rahat hərəkət etdirmək üçün mebellərin, royalın və s. ayaqlarında).

2. Elektrik məftillərini divarda, tavanda və s.-də bərkitmək üçün farfordan və s.-dən düzəldilmiş izolyator; fincan.

3. Təkərcikli konki; ayaq diyircəyi. *Rolik sürmək.*

**ROM** [*ing.* rum] Şəkər qamışı və ya patkasının qıcqırdılmış şirəsindən hazırlanan tünd içki.

**ROMALI** *is.* Qədim Roma dövlətinin vətəndaşı.

**ROMAN** *is.* [*fr.*] 1. Həcmcə böyük, adətən nəsrlə yazılmış böyük hekayə. *M.S.Ordubadinin tarixi romanları. – "Bahadır və Sona" öz üslubu ilə də fərqlənir. Bu kiçik roman lirik səpkidə yazılmışdır.* M.Arif. *Bu iki nəfərlik balaca ailənin roman qədər uzun, faciə qədər ağır bir keçmişi vardır.* Mir Cəlal.

2. *dan.* Kişi ilə qadın arasında yaranan sevgi macərası; eşqbazlıq.

**ROMANÇI** *is.* Roman yazan yazıçı. *M.S.Ordubadi Azərbaycan ədəbiyyatında romançı kimi tanınır. – Dil məsələsi dramaturq üçün daha ciddi bir məsələdir. Onun dili romançının dilindən fərqlidir*. C.Cabbarlı.

**ROMANİST** *is.* [*fr.*] Roman filologiyası mütəxəssisi.

**ROMANİSTİKA** [*rus.* əsli *fr.*] Roman dilləri və mədəniyyətini öyrənən elmlərin məcmusu; roman filologiyası.

**ROMANÍZM** [*fr.*] Roman dillərindən alınmış söz və ya ifadə.

**ROMÁNS** [*fr.*] 1. Fortepiano və ya başqa musiqi alətinin müşayiətilə oxunmaq üçün hər hansı bir şairin sözlərinə yazılmış kiçik vokal əsəri. *İndi bizim şöhrət qazanmış simfonik əsərlərimiz, romanslarımız, mahnılarımız vardır.* İ.Əfəndiyev. [Şura] *gecə gözəl piano çaldı, rusca romanslar oxudu*. A.Şaiq.

2. Musiqiyə köçürülmüş kiçik lirik əsər.

**ROMÁNTİK** [*fr.*] 1. Romantizmin (1 və 2-ci mənalarda) tərəfdarı və davamçısı. *Fransız romantikləri.*

2. İnsanları və həyatı idealizə edən; xəyalpərəst, hissiyyatçı.

**ROMANTÍK** *sif.* [*fr.*] 1. Əsasında romantika olan, romantika ilə dolğun. *Romantik poeziya. – C.Cabbarlı Elxanı romantik boyalarla təsvir etmişdir.* M.Arif. [Salman] *Muğanda ovçuluqdan, çöllü həyatının qəribə romantik macəralarından şirin-şirin danışdı.* M.İbrahimov. *Gənclərin qarşısında romantik bir mənzərə açıldı*. M.Hüseyn.

2. Xəyalpərəst, xəyalpərvər, seyrçi. *Romantik şair. – Dəmirçi Musa həyatı sevən,*

*onun gözəlliklərindən mütəəssir olub vəcdə gələn, pisliklə, paxıllıqla işi olmayan, romantik xəyallarla yaşayan, təmiz, xeyirxah bir adamdır.* İ.Əfəndiyev.

**ROMÁNTİKA** [*fr.*] 1. B a x **romantizm** 1 və 2-ci mənalarda. *Hüseyn Cavidin romantikası. – Romantika Almazın enerjisində, yaradıcılıq pafosunda, onun cəsarət və fədakarlığında, onun nikbinliyində, gələcək gözəl həyata olan inam və ümidindədir.* M.Arif. *Düşünüb deyirəm: nəyimə gərək; Uzaq sahillərin romantikası.* S.Rüstəm.

2. Emosional və yüksək hisslər yaradan hər hansı bir şey. *Azadlıq mübarizəsinin romantikası.*

**ROMANTİKLƏŞDİRİLMƏ** "Romantikləşdirilmək"dən *f.is.*

**ROMANTİKLƏŞDİRİLMƏK** *məch.* Romantik şəkildə təsvir edilmək, göstərilmək. *Əsərin qəhrəmanı romantikləşdirilmişdir.*

**ROMANTİKLƏŞDİRMƏ** "Romantikləşdirmək"dən *f.is.*

**ROMANTİKLƏŞDİRMƏK** *f.* Bir şeyi və ya adamı romantik, ideallaşdırılmış şəkildə göstərmək, təsvir etmək; ideallaşdırmaq. *Keçmişi romantikləşdirmək. Qəhrəmanı romantikləşdirmək.* – [Nizami, Xaqani, Nəsimi, Füzuli, Vaqif və Sabir] *insan gözəlliyini tərənnüm etmiş, insan zəkasını şöhrətləndirmiş, insanın böyük qəlbini və qadir məhəbbətini romantikləşdirmişdir.* M.Arif.

**ROMANTİZM** [*fr.* romantisme, *lat.* romanus – Romaya aid] 1. XIX əsrin birinci rübündə klassisizmin qanunları ilə mübarizə aparan, şəxsiyyət və hissiyyatı tarixi və xalq poetik mövzuları öz yaradıcılığı üçün əsas qəbul edən cərəyan.

2. Ədəbiyyat və incəsənətdə: insanın yüksək mövqeyini optimistcəsinə parlaq surətlərlə göstərməyə çalışan bədii üsul. *Mütərəqqi romantizm. İnqilabi romantizm.*

3. Hissiyyata qapılma, xəyalpərəstlik, seyrçilik.

**ROMB** [*yun.*] 1. Tərəfləri bərabər çəp paraleloqram.

2. *tar.* Sovet ordusunda ali komanda heyətinin fərqlənmə nişanı (1943-cü ildə poqon tətbiqinə qədər).

**ROMBABƏNZƏR** b a x **rombşəkilli**.

**ROMBAOXŞAR** b a x **rombvari**.

**ROMBOİD** [*yun.*] *riyaz.* b a x **paraleloqram**.

**ROMBŞƏKİLLİ** *sif.* Romba bənzəyən, romba oxşayan, romb kimi olan; paxlavaşəkilli. *Rombşəkilli nişan. – Açdı, qoydu altı-yeddi; romb şəkilli paxlavanı; Şam yandırdı, şölələri; necə parlaq, necə əziz.* X.Rza.

**ROMBVARİ** b a x **rombşəkilli**.

**RÓNDO** *is.* [*ital.*] Əsas mövzunun dəfələrlə təkrarlanması və onların arasında müxtəlif məzmunlu epizodların növbələşməsinə əsaslanan musiqi forması.

**RÓTA** [*pol.* rota] Batalyon tərkibinə daxil olan qoşun bölgüsü. [Quliyev] *gecə ikən rotalara, vzvodlara getdi.* Ə.Vəliyev. *Öz rotasından hələ heç kəsin sorağını almaması Tapdığı çox darıxdırırdı.* Ə.Əbülhəsən.

**ROTÁSİYA** [*lat.* rotatio – fırlanma] *mətb.*: **rotasiya maşını** – fırlanan silindrik mətbəə forması (qəlibi) olan çap maşını.

**RÓTMİSTR** [*pol.*] 1917-ci il bolşevik inqilabından əvvəlki rus süvari qoşunlarında zabit rütbəsi, habelə bu rütbədə olan zabit. [P.A.Qrinyov:] *Adının İvan İvanoviç Zurin, özünün isə qusar alayı rotmistri olduğunu öyrəndim.* A.S.Puşkindən.

**RÓTOR** [*lat.* rotare – fırlanma] Maşının (turbinin, motorun və s.-nin) fırlanan hissəsi. *Göz qoydu firlanan neçə rotora; Bu mədən ustası, mədən hakimi.* S.Vurğun. *Rotorun gurultusu bütün buruğu bürümüşdü.* M.İbrahimov.

**ROYÁL** [*fr.*] Metal simləri üfüqi düzülmüş klavişli (dilli) musiqi aləti. *Royal çalmaq.*

**ROYALİ́ST** *kit.* Padşahpərəst, monarxist.

**ROYALİ́ZM** [*fr.*] Padşah hakimiyyəti tərəfdarlığı; padşahpərəstlik.

**ROZMARİ́N** [*lat.*] 1. *bot.* Yarpaq və çiçəyindən ətirli yağ hasil edilən dodaqçiçəklilər fəsiləsindən həmişəyaşıl yarımkol.

2. İncə ətri olan turşməzə qış alma növü. *Ağ rozmarin.*

**RÖVNƏQ** *is.* [*ər.*] *klas.* Parlaqlıq, gözəllik, zinət; lətafət, təravət; işıq. *Gülşənin rövnəqisən, zinəti bağü çəmənin.* M.P.Vaqif. *Nədən qəhrəmanım çıxmayır düzə? Rövnəq deyilmidir günəş gündüzə?* M.Rahim. ◻ **Rövnəq tapmaq** – daha da gözəlləşmək, təravətlənmək, parlaq olmaq. *Ömür rövnəq tapır*

*könül güləndə; İnsanın qədrini insan biləndə.* S.Vurğun. *Yarandı qardaşlıq, bir də məhəbbət; Könül rövnəq tapdı, qəlb işıqlandı.* Aşıq Şakir. **Rövnəq vermək** – 1) bir şeyin gözəlliyini, parlaqlığını, yaraşıq və lətafətini artırmaq; gözəlləşdirmək, zinətləndirmək. *Oxuyur hər biri beş-altı vərəq; Sonradan saqqala verir rövnəq*. S.Ə.Şirvani. *Ömrümə rövnəq verən, minnətsiz minnət çəkən, ağrıma dözən Ruqiyyə idi, Ruqiyyə...* A.Divanbəyoğlu. *Eşqin qüdrətlidir... Bu eşq ilə sən; Qara torpağa da rövnəq verərsən.* B.Vahabzadə; 2) qüvvət vermək, rəvac vermək, daha da inkişaf etdirmək. *İbrahim günü-gündən ticarətinə rövnəq verib böyük bir tacir oldu.* (Nağıl). **Rövnəqdən düşmək** – gözəlliyini itirmək, təravətdən düşmək, əvvəlki gözəlliyini, təravətini, lətafətini, parlaqlığını itirmək. *Buradan nə qədər gül-çiçək dərsəydilər, yenə də gülşən rövnəqdən düşməzdi.* M.Hüseyn. *Eyşü işrət məclisi, əlbəttə, rövnəqdən düşər; Naleyi-ney, şuri-mütrüb, nəğmeyi-tar olmasa.* Ə.Vahid. **Rövnəqdən salmaq** – 1) təravətini, gözəlliyini pozmaq; 2) *məc.* yayılmağa, inkişaf etməyə qoymamaq. *Təziyə məclislərini rövnəqdən salmaq məqsədilə kinolar və sair ictimai əyləncələr təşkil edilsin.* M.S.Ordubadi. **Rövnəqi pozulmaq** – b a x **rövnəqdən düşmək**. *Rövnəqi pozulub otağımızın; Ziyası qalmayıb çırağımızın.* Q.Zakir.

**RÖVNƏQLƏNDİRMƏ** "Rövnəqləndirmək"dən *f.is.*

**RÖVNƏQLƏNDİRMƏK** *f.* b a x **rövnəq vermək** ("**rövnəq**"də).

**RÖVNƏQLƏNMƏ** "Rövnəqlənmək"dən *f.is.*

**RÖVNƏQLƏNMƏK** *f.* b a x **rövnəq tapmaq** ("**rövnəq**"də).

**RÖVNƏQLİ** *sif.* Gözəl, parlaq, təntənəli. *Rövnəqli məclis*. – *..Şəhərin halını qubernatora rövnəqli* (z.) *surətdə göstərməyi hər kəs özünə müqəddəs bir vəzifə bilirdi*. Çəmənzəminli.

**RÖVŞƏN** *sif.* [*fars.*] *klas.* İşıqlı, parlaq, aydın. *Səninlə rövşən idi qəlbim, ey gözüm nuri!* X.Natəvan. *Ey çocuq ruhu qədər şən Göy göl; Köksü almas kimi rövşən Göy göl!* M.Müşfiq. □ **Rövşən etmək (qılmaq)** *klas.* – işıqlandırmaq. *Bir gecə ol şəmlə çeşmin sarayın rövşən et*. Qövsi. *Sinəsi büllur kimi; Ətrafı rövşən elədi.* Aşıq Ələsgər. *İştə bulud parçaları ayrıldı; Ay parladı, dünyanı rövşən qıldı.* A.Səhhət. **Rövşən olmaq** – işıqlanmaq, aydın olmaq. *Soyuq küləklər əsən bir yerdə, bir məkanda; İki yüz şam alışdır, yenə də rövşən olmaz.* Şəhriyar.

**RÖVŞƏNLİK** *is.* İşıqlıq, aydınlıq, parlaqlıq. *Aləmin rövşənliyi gərçi günəşdəndir, vəli; Pərtovü mehri-cəmalın mahtab üstündədir.* Xətayi.

**RÖVZƏ¹** *is.* [*ər.*] *din.* Şiə imamlarının ölümü haqqında hekayə; mərsiyə. *Mey gətir saqi, məni qurtar nəmazü rövzədən.* Kişvəri. *İyirmi beş gün tamamdır ki, bəstdə oturanlar gündüzlər rövzə və nitq söyləyirdilər.* P.Makulu. // Bu cür hekayələr, mərsiyələr oxunulan yer, məclis. [Yaşlı kişi:] *Mən günorta azanını gözləyirdim ki, qalxıb rövzəyə gedim*. S.Hüseyn.

**RÖVZƏ²** *is.* [*ər.*] *klas.* 1. Axar suyu, çəməni olan bağça (adətən "rövzeyi-gülşən", "rövzeyi-kuy" və s. tərkib halında işlənir). *Rövzeyi-kuyində gəzəndə əğyar; Çeşmim girdabında sellər dolanır*. M.P.Vaqif.

2. *məc.* Behişt, cənnət. □ **Rövzeyi-rizvan** – cənnət, behişt. *Şikəstə qafiləm, ey şux nigarım! Rövzeyi-rizvanım hanı, görünməz.* Aşıq İbrahim. *Bizə öz yurdumuz əfsanə behiştdən xoşdur; Zahid öz rövzeyi-rizvanına çıxsın, getsin*. Ə.Vahid.

**RÖVZƏXAN** *is.* [*ər.* rövzə və *fars.* xan] Rövzə oxuyan, mərsiyə deyən adam. *Doğrudurmu ki, Bədəl də qoyub ağzın yabana; Danışır bir para sözlər ki, dəyir rövzəxana?* M.Ə.Sabir.

**RÖVZƏXANLIQ** *is.* Rövzəxanın işi, peşəsi; mərsiyəxanlıq. *Molla Xəlil orucluqda vaizlik, məhərrəmlikdə rövzəxanlıq edər.* S.Hüseyn. [Qurban:] *Deməli, sən rövzəxanlıq eləyib, o alimi tərifləyəndə almalar tökülməyəcək?* Ə.Məmmədxanlı.

**RÖYA** *is.* [*ər.*] 1. Yuxu. [Xanəndə:] *Röyadə mən keçən gecə eylərkən ahüzar; Sən vermədinmi bir əbədi vəsl için qərar?!* H.Cavid. □ **Röya görmək** – yuxu görmək. *Hər gün əğyarə nəsib oldu cəmalın, ey məh; Ol-*

*madı bir gecə kim, mən səni röyadə görüm.* S.Ə.Şirvani. [Qüdrətin] *gözünə yuxu gedəndə qarışıq röyalar görməyə başladı*. M.Hüseyn.

2. Yuxuda görülən şey, vaqiə, hadisə. *Bu sərv qamət, bu cazibəli gözlər, siyah danə... Bunlar röyamı?* Çəmənzəminli. *Bu, yuxu ilə oyaqlıq arasında elə bir hal idi ki, həqiqət, xəyal, röya bir-birinə qarışmışdı*. M.Rzaquluzadə.

**RU(Y)** *is.* [*fars.*] *klas.* Üz, çöhrə. *Həsrətindən zəfəranə dönsə ruyim, yox əcəb; Qoymuş hicranda məni, bir gülüzarım gəlməmiş.* M.P.Vaqif. *Düşübdür xəyalım yarın ruyinə; Can quşu bənd olub zülfü muyinə*. M.V.Vidadi. *Zülfün ki, tutub ruyunu, çox qorxuram ondan; Aləm toxunar bir-birinə zülmət olanda*. Ə.Vahid. ☐ **Ruyi-zəmin** *klas*. – Yer üzü; dünya, aləm. *Bu şəhri-Qəzvində bir nəfər nabəkar peyda olubdur ki, cəmi-ruyi-zəmində ondan qətlə müstəhəq bir kimsənə tapılmaz*. M.F.Axundzadə.

**RUBA** *is.* Bir pud ağırlığında olan köhnə çəki ölçüsü. [Xeyransanın] *Hacı Manafdan aldığı isə yalnız bir ruba taxıl olmuşdu.* S.Hüseyn.

**RUBƏRU** *zərf* [*fars.*] Üz-üzə, üzbəüz. *Rubəru oturmaq. Rubəru dayanmaq. – Mirzə Rəhim ağa Böyükxanımın sözlərini eşidəndən sonra bir az da yaxınlaşıb rubəru əyləşmişdi*. M.S.Ordubadi. [Rəşid:] *İnanmayıram ki, bu iki ay qurtarsın və səninlə rubəru söhbət etmək bir daha mənə nəsib olsun.* İ.Musabəyov. ☐ **Rubəru olmaq** – bax **üz-göz olmaq** ("**üz-göz**"də).

**RUH** *is.* [*ər.*] 1. İnsanın psixi aləmi, onun hiss və duyğuları, əhvali-ruhiyyəsi. [Xəlilin] *bir an sıxılan ürəyi haman açıldı, səbəbsiz bir nəşə ruhuna hakim oldu*. Çəmənzəminli. *Torpağı bəzəsin bənövşə, nərgiz; Ruhuma doğmadır hər cığır, hər iz*. H.Arif. // Fəlsəfədə və psixologiyada ideal olanla, şüurla, maddi başlanğıcdan fərqli olaraq qeyri-cismani başlanğıcla eyniyyət təşkil edən anlayış; sözün dar mənasında şüur, təfəkkür. *Subyektiv ruh. Ruhun varlığı. Antik fəlsəfə ruhu nəzəri fəaliyyət hesab etmişdir.* // Hər şeyin və hadisənin əsasını təşkil edən və materiyaya nisbətən birinci olan qeyri-maddi aləm. *Mütləq ruh*. // Təsəvvürə görə, insanda, onu digər canlılardan ayıran və Allaha qovuşduran ölməz, qeyri-maddi varlıq; can. [Molla Kazım:] *Hamısının ruhu bu dəmdə cənnətdədir*. Ə.Haqverdiyev. [Nənəxanım:] *A kişi, .. bir yerdə yeyək, cümə axşamıdır, elə ölülərimizin də ruhu şad gedər*. Çəmənzəminli.

2. İnsanın daxili halı, mənəvi qüvvəsi, mənəviyyatı; həvəs, hiss, duyğu, canlılıq. *Onun heç ruhu yoxmuş. – ..İnsanda bir azca ruh da gərək olsun, yoxsa qanacaqsız adamnan mənim aram yoxdur*. C.Məmmədquluzadə. [Əsgər:] *Ürəyin yanırsa görünür ki, sənin. ruhun var, ay xala!* Ü.Hacıbəyov. // *məc*. Cürət, qoçaqlıq, cəsarət, mərdlik. *Əsgərlərdə döyüş ruhu yaratmaq. – İlk müvəffəqiyyət məndə inam və ruh yüksəkliyi doğurdu*. A.Şaiq. *İşçilərin ruhları yüksək idi*. H.Nəzərli.

3. *məc*. Hər hansı bir şeyin səciyyəvi xüsusiyyəti, əsas mahiyyəti, ən lazımlı, ən əsas nöqtəsi. *Məsələnin ruhunu tapmaq. Söhbətin ruhunu bilmək.*

4. Dini və mifoloji təsəvvürə görə: insanın həyatında və təbiətdə iştirak edən qeyri-maddi, fövqəltəbii bir varlıq.

5. *məc*. Ürək, qəlb. *Yar yarına gündə olsa müqarin; Könülü şən olur, ruhu tellənir.* Qurbani. *Qızdırmadan bədənim narahat olur, amma qızıl dükanlarından ruhum rahatsız olur*. C.Məmmədquluzadə. *Müəllim* [Tellinin] *ruhunun ən həssas nöqtəsinə toxunmuşdu*. S.Hüseyn.

6. Nəvazişli xitab yerində: **mənim ruhum, ruhum** şəklində işlənir. *Ruhum! Ey şəhbazi-ülviyyət; Hümmətim tək fəzada pərvaz et!* M.Ə.Sabir. [Qətibə:] *Mənim ruhum, mənim sirr yoldaşım, sənə nə fəlakət üz vermişdir?* M.S.Ordubadi.

7. **Ruhla** şəklində *zərf* – 1) həvəslə, şövqlə, ruh yüksəkliyi ilə. *Hidayət yuxudan həvəslə, ruhla ayılmışdı*. B.Bayramov; 2) ...əhvali-ruhiyyə ilə. *Fikirləşdi ki, indi* [Səməd] *əmisinin evinə tamam başqa bir ruhla qədəm basacaqdır.* İ.Hüseynov.

◊ **Ruh azarı** – ruhi xəstəlik. [Hacı Nayib:] *..Doktor ruh azarının burada camaat içində nə şəkildə zühura gəlməyini tədqiq və təhqiq*

*edib, .. elmi-psixiqə tətbiq buyursunlar*. C.Məmmədquluzadə. **Ruh düşkünlüyü** – bədbinlik, düşkün əhvali-ruhiyyə, ümidsizlik. *Bu müraciətnamədən sonra Təbriz xalqında böyük bir ruh düşkünlüyü yarandı*. M.S.Ordubadi. *Şükür açıqcasına görürdü ki, ətrafına toplaşan adamlarda ruh düşkünlüyülə qarışıq bir narazılıq var*. S.Hüseyn. **Ruh gəlmək** – canlanmaq, cana gəlmək; ruhlanmaq; cəsarət gəlmək. *Bizi vermə düşmana! Bir ruh gəldi Aslana*. S.Vurğun. **Ruh təzələnmək** – şənlik düşmək, ürəklər açılmaq. [Çənlibeldə] *məclis quruldu, keflər duruldu, saqi dolandı, ruh təzələndi*. "Koroğlu". *Nazənin-nazənin edərsiz avaz; Ruhlar təzələnir, olur sərəfraz*. M.P.Vaqif. **Ruh vermək** – ruhlandırmaq, ilhamlandırmaq, ilham vermək. [Günəş] *sonra yavaş-yavaş qalxıb, .. ruh verən qızıl zərrələrini aləmə dağıdıb bütün yatmışları oyatdı*. S.S.Axundov. *Böyük Füzuliyə ruh verən ellər; Özünü tarixə göstərən ellər; Hər zaman Cəfəri yetirəcəkdir!* M.Müşfiq. **Ruha yatan** – xoşa gələn, ürəyə yatan, ruhu oxşayan. **Ruhdan düşmək** – bədbin olmaq, həyatdan küsmək, bədbinləşmək. *Kamal .. ruhdan düşməyib* [Cavadı] *başqa bir xəbərlə sevindirmək istədi*. S.Vəliyev. **Ruhdan salmaq** – hərəkət və sözləri ilə birini işdən soyutmaq, həvəsdən salmaq, marağını öldürmək. *Sığışdıra bilməyib; Paxıl arı bu dərdi; Dedi: – Gərək mən onu; Ruhdan salıb öldürəm*. M.Dilbazi. **Ruhu təzələnmək** – ruha gəlmək, şənlənmək, canlanmaq, cana gəlmək. [Qurban:] *Bəh... bəh... Ruhum təzələndi, qəribə içkidir*. Ə.Haqverdiyev. **Ruhu uçmaq** – son dərəcə xoşlanmaq, ürəyi açılmaq, ruhlanmaq, cuşa gəlmək, son dərəcə fərəhlənmək. [Sara Pəriyə:] *Gedək bağçaya, belə yaxşı havadır ki, insanın ruhu uçur*. C.Cabbarlı. **Ruhu(n) şad olsun!** – vəfat etmiş bir adamı anarkən hörmət məqamında işlənən ifadə. [Bəxtiyar] *Dedi: – Mən o günü gördüm, Şəhriyar; Qabaqda işıq var, ruhun şad olsun*. B.Vahabzadə. **Ruhunu dindirmək** – bax **ruhunu oxşamaq**. *Ürkək baxışlarınla ruhumu dindirəydin; Məni sevindirəydin*. M.Müşfiq. **Ruhunu oxumaq** – ürəyindən keçəni bilməyə çalışmaq, qəlbini oxumaq. *Nadir bəy hər ikisilə* [Səltənət və qızı Humayla] *əl-ələ verib görüşər və Humayın ruhunu oxumaq üçün gözlərinə diqqət edər*. H.Cavid. **Ruhunu oxşamaq** – məftun etmək, qəlbinə xoş gəlmək, ürəyinə yatmaq, qəlbini oxşamaq. [Xəyyam:] *Yox, oxşayacaq ruhumu bir zərrə səadət; İzlər məni hər dürlü fəlakət*. H.Cavid. [Sitarə:] *Ax, Gülzar, məhəbbət .. hərdən ürəyimi parçalayır, hərdən ruhumu oxşayır*. C.Cabbarlı. **Ruhunu oynatmaq** – həvəsləndirmək, fərəh vermək, cuşa gətirmək. *Onun da ruhunu oynadır sənət; Qoynunda bəsləmiş onu təbiət*. S.Vurğun. **Ruhunu torpağa tapşırmaq (təslim etmək)** *tənt*. – vəfat etmək, ölmək. **Ruhunun da xəbəri olmamaq** – qətiyyən xəbəri olmamaq, bilməmək, əlaqəsi olmamaq. **Heç ruhu da inciməmək** – heç xəbəri olmamaq, heç hiss etməmək, heç ağrı-əziyyət duymamaq; rahat, əziyyətsiz olmaq. *Cəllad hazır olub dedi: – Şah sağ olsun, buyruq qibleyi-aləmindir! Kimi deyirsən, bu saat boynunu elə vurum ki, ruhu da inciməsin*. (Nağıl). [Toğrul:] *Özüm ölüm, iynəni elə vuracağam ki, heç ruhun da inciməyəcək*. C.Cabbarlı.

**RUHANİ**[1] [*ər*.] 1. *is*. Din xadimi. *Əqdi-nikah mərasimi olduqca təntənəli keçdi, bütün Şuşa ruhanilərinə xələt verildi*. Çəmənzəminli.

2. *sif*. Din ilə bağlı olan, dinə aid olan; dini. *..Millətin ruhani ataları – mollalar millətin avamlıqda qalmaqlarından nəfbərdar olub, zahirdə dediklərinə batində əməl etmirlərmiş..* F.Köçərli. *Atam ruhani idarəsindən çıxmağa məcbur olmuşdu*. A.Şaiq. // Din tədris edilən. *Ruhani məktəb*.

3. *sif*. Ruhla bağlı olan, ruha aid olan. *Həyatın mənşəyinin ruhani başlanğıcla bağlılığı*.

4. *sif*. Qeyri-cismani, qeyri-maddi; mənəvi, xəyali, mücərrəd. *Həqiqət, axır vaxtadək Bahadırın Sonaya və Sonanın Bahadıra olan ruhani məhəbbətlərində şəkk yox idi*. N.Nərimanov.

5. *is*. Sazda çalınan aşıq havalarından birinin adı.

◊ **Ruhani ata** *məc*. – tərbiyəçi, mürəbbi, tərbiyə verib yetişdirən adam; ustad, yol göstərən. *Ruhani ataydı şagirdlərinə; Köksü dar*

*gələrdi iftixarına; Ondakı məhəbbət, ondakı şəfqət; Sığmırdı insanlıq hüdudlarına*. Şəhriyar.

**RUHANİ²** *sif.* [*ər.*] *klas.* Lətif, gözəl mənzərəli, ab-havası gözəl; ruhu oxşayan. *Ruhani bir mənzərə. – Nə gözəl mənzəreyi-şəfqətza; Nə lətafətli, nə ruhani səfa.* M.Hadi. *Ən ruhani nəşələrdən qanadım; Çıxdım, səni buludlarda aradım!* Ə.Cavad.

**RUHANİLİK** *is.* Ruhani¹ (1-ci mənada) olma, din xadimliyi, dini işlərlə məşğul olma. *Peyğəmbərlik tam ruhanilikdir, çünki insanlıq dərəcəsində pəyğəmbərlikdən daha yüksək mövqe yoxdur.* "Qabusnamə".

**RUHANİYYƏ(T)** [*ər.*] *klas.* bax **ruhanilik**.

**RUHƏN** *zərf* [*ər.*] Mənən, mənəvi cəhətdən, ruhca. *Ruhən bağlı olmaq. – Ruhən doğulan parıltı, rövnəq; Zahirdə verir büruzə, mütləq*. Şəhriyar.

**RUHİ** *sif.* [*ər.*] 1. İnsanın daxili aləmilə, mənəviyyatı ilə bağlı olan; mənəvi. *Ruhi əzab. Ruhi vəziyyət. – Laçın heç vaxt bugecəki kimi ruhi iztirab keçirməmişdi.* M.Hüseyn. [Bəhram] *da ixtiyarsız olaraq ani bir ruhi sıxıntı duydu*. Ə.Vəliyev.

◊ **Ruhi xəstə** – dəli. **Ruhi xəstəliklər** – insanın psixi fəaliyyətinin və əsəblərinin pozulması ilə bağlı olan xəstəliklər.

**RUHİ-RƏVAN** *is.* [*ər.* ruh və *fars.* rəvan] *klas.* Sevgili, istəkli. *Sən mənim cananım, ruhi-rəvanım; Ləbləri şirinim, qönçə dəhanım.* M.P.Vaqif. [Xanəndə:] *Gəl sevgili yarım, gözəlim, qönçə dəhanım! Gəl, ruhi-rəvanım!* H.Cavid.

**RUHİYYAT** [*ər.*] *köhn.* bax **psixologiya**. *Buna nə ruhiyyat alimi olmaq, nə də filosoflar içində görkəmli yer tutmaq kömək edə bilməzdi..* M.S.Ordubadi.

**RUHİYYATÇI** *is.* [*ər.*] *köhn.* bax **psixoloq**. *Mən sadə tacir deyiləm, mən müştərinin nə kimi mətaya maraqlı olduğunu gözlərindən oxuyan bir ruhiyyatçıyam.* M.S.Ordubadi.

**RUHLANDIRICI** *sif.* 1. Ruh verən, ruhlandıran, ruha gətirən, ilhama gətirən. *Ruhlandırıcı amillər. Ruhlandırıcı mənzərə.*

2. Ürəkləndirən, cəsarətverici, qüvvətverici, qüvvət və təsirini artıran. *Ruhlandırıcı sözlər.*

**RUHLANDIRMA** "Ruhlandırmaq"dan *f.is.*

**RUHLANDIRMAQ** *f.* Ürək vermək, cəsarət vermək, ürəkləndirmək. *Birinci gün olduğu kimi yenə də Cavad irəlidə gedir, döyüşçüləri ruhlandırırdı.* Ə.Vəliyev. *Arzusuna çatmaqdan doğan bir fərəh Fərmanı ruhlandırmışdı.* Ə.Sadıq.

**RUHLANMA** "Ruhlanmaq"dan *f.is.*

**RUHLANMAQ** *f.* 1. Ürəklənmək, cəsarətlənmək, qüvvət almaq, cuşa gəlmək. *Ruhlanın Babəkin xatirəsindən; Bizi igidliyə çağırır Vətən.* S.Vurğun. *Mürsəl kişi danışdıqca ruhlanırdı.* M.Hüseyn. // *məc.* Canlanmaq, cana gəlmək. *Çiçəklər, otlar, güllər bahar günəşinin ılıq şüası altında ruhlanıb, təravətlənib gözəl qoxuyurdular*. Çəmənzəminli.

2. *məc.* Təbə gəlmək, vəcdə gəlmək, ilhamlanmaq. *Oxu, tar, ruhlansın; Şirvanın, Gəncənin mehriban gözəli!* M.Müşfiq.

**RUHLU** *sif.* Ruhu (2-ci mənada) olan, həvəsli, gözəl bir şeydən ruhlanan, təsirlənən, vəcdə gələn, şövqlənən. *Çox ruhlu adamdır.*

**RUHNƏVAZ** *sif.* [*ər.* ruh və *fars.* ...nəvaz] *klas.* bax **ruhoxşayan**. *..Bufet və restoranlarda çalınmaqda olan musiqilərin ruhnəvaz səsi eşidilirdi.* S.Hüseyn.

**RUHOXŞAYAN** *sif.* Ruha xoş gələn, ruhu oxşayan, ruh verən, ürəyəyatan. *..Ataş elə bil ömründə bu cür ürəyəyatan, ruhoxşayan, könülaçan axşam görməmişdi.* Ə.Vəliyev.

**RUHOXŞAYICI** bax **ruhoxşayan**. *Simfoniyanın ruhoxşayıcı melodiyaları pərdə-pərdə yayılır.*

**RUHPƏRVƏR** *sif.* [*ər.* ruh və *fars.* ...pərvər] *klas.* Həyat verən, ruha qüvvət verən; canlandırıcı. ruhlandırıcı. *..Mən bu gün bir neçə xəbərlər eşitmişəm ruhpərvər və pakizə, ona görə şadlığımdan bilmirəm nə edəm.* N.Vəzirov. [Sitarə və oğlan] *gül yığıb, çiçəklər dərib, qoxusundan ruhpərvər olurdular.* Çəmənzəminli.

**RUHSUZ** *sif.* Süst, ölgün, ətalətli, həvəssiz, heç bir şeydən ruhlanmayan, təsirlənməyən. *Ruhsuz adam. Ruhsuz* (z.) *danışmaq. – Nə gurultu, nə küy, nə səs vardır; Bir neçə ruhsuz qəfəs vardır*. A.Səhhət. *Yaşamaz eşqsiz, ruhsuz sənətkar; Onun varlığı da quru sümükdür.* S.Vurğun.

**RUHSUZLUQ** *is.* Süstlük, ölgünlük, ətalətlilik, həvəssizlik, maraqsızlıq; laqeydlik, ruh düşkünlüyü. *İnci kimi tər tökən sinəsinin qaralıb təndir qapağına dönməsi onun üçün heç bir təəssüf, hüzn və ruhsuzluq gətirə bilmədi*. Mir Cəlal.

**RUHŞÜNAS** *sif.* [*ər.* ruh və *fars.* ...şünas] *köhn.* bax **psixoloq** 2-ci mənada. [Mirzağa] *Cəmilə kimi təmiz, ruhşünas, munis, eyni zamanda gözüaçıq, gözəl bir qız haradan tapacaqdı?* S.Hüseyn.

**RUHVERİCİ** *sif.* və *zərf* Ruh verən, ruhu oxşayan, ruhlandıran. *Ruhverici musiqi. Ruhverici söhbət. – Məşədibəy dərdini-sərini demək, nə isə ruhverici bir söz eşitmək üçün yaxın bir dost axtarırdı.* M.Hüseyn.

**RUL** [*holl.*] Avtomobilin, təyyarənin və s.-nin müəyyən istiqamətdə hərəkətini idarə etmək üçün qurğu; sükan. [Ağabala:] *Buyur, əyləş rulun dalında, sür, biz də öyrənək!* Mir Cəlal. [Səriyyə:] *Mən rul arxasında oturmuş Adili görüb: – Bay! – deyə bərkdən səsləndim.* İ.Əfəndiyev.

**RULET** [*fr.*] 1. Döyülmüş ətdən və ya kartofdan uzunsov şəkildə iç qoyularaq hazırlanan yemək.

2. Lay-lay xəmirdən girdə və ya uzunsov şəkildə hazırlanan içli şirin çörək.

**RULETKA** [*fr.*] 1. Futlyar içində vala sarınıb və lazım olduqca çıxarılan ölçü lenti (poladdan, kətandan və ya müşəmbədən qayrılır).

2. Həmin adlı bir növ qumar oyunu üçün xüsusi qurğu (bu qurğu, üzərində nömrələnməsi yuvacıqlar olan, fırlanan dairə şəklindədir və udmaq üçün bu dairə içərisində yuvarlanan şar mütləq yuvacıqların birinin içinə düşməlidir).

**RULON** [*fr.*] Lülə şəklində bükülmüş, sarınmış şey (müşəmbə, kağız, parça və s.). *Kağız rulonu. Tol rulonu.*

**RUM** *klas. tar.* Əslən yunan olub müsəlman məmləkətlərində yaşayan əhaliyə və bu əhaliyə mənsub adamlara verilən ad. *Cəm oluban rumü əcəm oynasa; Həzzim olmaz hərgiz özgədən, gəlin!* M.P.Vaqif.

**RUMB** [*ing.*] Kompasın dairəsində (horizontun $^{1}/_{32}$ hissəsinə müvafiq olan) bölgü.

**RUMBA** *is.* [*isp.*] Meksika mənşəli müasir rəqs növü.

**RUMIN(LAR)** Rumıniyanın əsas əhalisini təşkil edən xalq və bu xalqa mənsub adam.

**RUMINCA** *sif.* və *zərf* Rumın dilində. *Rumınca-rusca lüğət. Rumınca öyrənmək.*

**RUMKA** [*holl.* roemer – qədəh] *dan.* bax **qədəh**. *Meyxanada dostlar bir-birinin sağlığına hərəsi altı böyük rumka konyak vurdular və yaxşı Göycə balığının kababını məzə etdilər*. E.Sultanov. [Rəcəb:] *Bir rumka araq içsək, keçər gedər.* Qantəmir. *Naşad yenə onun rumkasını doldurdu. Zeynal bir də içdi*. S.Hüseyn.

**RUPİYƏ** [*sanskr.*] Hindistanda, Pakistanda və bir sıra başqa ölkələrdə: pul vahidi, həmçinin Hindistanda və Pakistanda gümüş pul.

**RUS** *is.* Rusiya Federasiyasında yaşayan əhalinin əksəriyyətini təşkil edən Şərqi slavyan xalqı və bu xalqa mənsub adam.

**RUSCA** *sif.* və *zərf* Rus dilində. *Rusca danışmaq. Rusca-azərbaycanca lüğət.*

**RUSİ** *köhn.* Rus dili, rusca. *Biri həm rusidir kim, bilməyi bizlərə lazımdır*. S.Ə.Şirvani.

**RUSİST** *is.* Rus filologiyası mütəxəssisi.

**RUSİSTİKA** [*rus.*] Rus dili və ədəbiyyatını öyrənən elmlərin məcmusu; rus filologiyası.

**RUSİYALI** *sif.* və *is.* Rus, Rusiya əhalisindən olan. *Rusiyalı dostum.*

**RUSİZM** *is. dilç.* Rus dilindən alınmış söz və ya ifadə.

**RUSLAŞDIRILMA** "Ruslaşdırılmaq"dan *f.is.*

**RUSLAŞDIRILMAQ** *məch. köhn*. Rus dili və mədəniyyəti qəbul etdirilmək.

**RUSLAŞDIRMA** *is. köhn.* Çar Rusiyasında: rus olmayan xalqlara rus dili və adətlərini zorla qəbul etdirmə siyasəti.

**RUSLAŞDIRMAQ** *f. köhn.* Çar Rusiyasında: rus olmayan xalqları dil və adətlərə görə rus etmək.

**RUSLAŞMA** "Ruslaşmaq"dan *f.is.*

**RUSLAŞMAQ** *f. köhn.* Rus dili və adətlərini qəbul etmək; rus olmaq. *Orda* [Kremldə] *sosialistlərin ruslaşan təməli var; Nerdə bir canavarlıq, bir cinayət çıxarsa; Orda barbar, kommunist Moskvanın əli var!* A.İldırım.

**RUSTÜMBAZ** [*fars.*] b a x **kəndirbaz**.

**RUTİL** *is.* [*lat.*] Qırmızımtıl rəngdə mineral.

**RUZ** *is.* [*fars.*] *klas.* Gün, gündüz. ☐ **Ruziəzəl** *klas.* – ibtida, lap başlanğıc. **Ruziəzəldən** *klas.* – ibtidadan, birinci gündən, lal əvvəldən. **Ruzi-məhşər (həşr)** *din.* – qiyamət günü. *Vaiza, təqrir qılma çox da ruzihəşrdən; Aşiq üçün ruzi-məhşər yarın ayrılmağıdır.* S.Ə.Şirvani. **Ruzü şəb** – gecəgündüz. *Kim ki, qeyrətə, zəhmətə alışar; Kəsbi-irfana ruzü şəb çalışar.* M.Ə.Sabir.

**RUZİ** *is.* [*fars.*] Azuqə, yeyəcək. *Qonağın ruzisi özündən qabaq gələr.* (Ata. sözü). [Şahmar:] *Əgər bu çinar yeməli meyvə gətirsə, özü də yaxşı tutsa, bütün bir kəndin ruzisi olar.* B.Bayramov. ☐ **Ruzi etmək (eləmək)** – azuqə kimi işlətmək, yeyəcək kimi istifadə etmək. [Fərəc:] *Bir şey yığıb verərsiniz, mən də aparıb özümə ruzi edərəm.* Qantəmir. [Mirzə] *meşənin pencər və otundan ruzi etməyə başladı.* S.Rəhimov. **Ruzi qazanmaq, ruzisini çıxarmaq** – gündəlik yemək-içməyini əldə etmək, çörəkpulu qazanmaq. [Kazım:] *İndi .. xanın sayəsində təzətəzə uyuşub, balalarımın ruzisini çıxarıram.* Çəmənzəminli. **Ruzimi (ruzini, ruzisini) əldən buraxmaq (çıxarmaq)** – əlinə düşən nemətdən, azuqədən məhrum olmaq; uduzmaq. [Ovçu:] *Nə üçün ruzimi əlimdən buraxım, nə üçün halal malımı sənə bağışlayım?* Ə.Məmmədxanlı. **Ruzisini kəsmək** – yeyəcəkdən məhrum etmək, yeyəcəyini əlindən almaq, yeyəcəksiz qoymaq; ac qoymaq. [Nəcəf] *uşaqların ruzisini kəsəndə belə olar.* İ.Əfəndiyev.

**RUZİGAR** *is.* [*fars.*] 1. Külək, yel. *..Bakı axşamına məxsus sərin ruzigar əsməkdə idi.* M.S.Ordubadi. *Çılğın kimi ruzigar vıyıldar; Qar parçaların göyə sovurar.* A.Şaiq. *Kəndin kənarındakı əkinlərin başaqları xəfifcə əsən bir ruzigarın təsiri ilə sakit bir dəniz kimi ləpələnir.* S.Hüseyn. // *məc.* Təşbehlərdə: iti, sürətli mənasında. *Uçun ey vətənin ruzgar qanadlı; Şahin təbiətli mərd oğulları!* Ə.Cəmil.

2. Hava mənasında. *Ruzigar qaranlıqlaşdı. Ruzigar buludlaşdı. – Bəzən də ruzigar dəyişir, hava elə quraq keçir ki, cücü əlindən yollardan ötmək olmur.* Mir Cəlal.

3. *məc.* Dövran, zəmanə; tale, fələk. *Olur tədbirimə bir gün müvafiq ruzigar, əlbət.* S.Ə.Şirvani. [Xədicə:] *Necə ağlamayım ki, illər ilə bəslədiyim məhəbbəti ruzigar puç etmək istəyir.* N.Nərimanov.

4. *məc.* Ömür, yaşayış, həyat, gün. *Neçə gündür didarını görmənəm; Ruzigarım qara günə bağlandı.* M.P.Vaqif.

5. Güzəran, vəziyyət, gün, hal. *Yenə təzələndi dövran; Nə gözəl ruzigar oldu.* Q.Zakir. [Tafta:] *Qabaqlar* [Sevili] *gördüm, göz gərək ruzigarına ağlasın.* C.Cabbarlı. *Ana mehriban gözlərini Cəmilə dikib balasının ağır ruzigarına acıyırdı.* S.Rəhimov. ☐ **Ruzigarını keçirmək** – gün(ünü) keçirmək, birtəhər yaşamaq, həyat sürmək. *Yoldaşımın sənəti baqqaldı, yəni bir daxmaya üç-dörd pud duz, bir qutu kişmiş və dörd-beş paçka maxorka tütünü qoyub satır və o da bu cür ruzigarını keçirir.* C.Məmmədquluzadə.

◊ **Ruzigarı bəd əsmək** – bəxti gətirməmək, bəxti küsmək, taleyi üz döndərmək. *Biçarə Məhəmmədin ruzigarı bəd əsdi; Üzünə saldı, gəldi bu altıncı qız – "Bəsti".* Ə.Cavad.

**RUZİSİZ** *sif.* və *zərf* Ruzisi olmayan, yeyəcəksiz, yeyəcəyi olmayan, azuqəsiz. ☐ **Ruzisiz qoymaq** – azuqəsini, ruzisini əlindən almaq, yeyəcəksiz qoymaq, ac qoymaq, aclığa məhkum etmək. [Qurbanəli:] [Vəli bəy] *uşaqlarımı ruzisiz qoydu.* S.S.Axundov.

**RUZNAMƏ** *is.* [*fars.*] *köhn.* Qəzet. *İki sənə bundan əqdəm .. "İrşad" ruznaməsinin nömrələrində öz daxili işlərimizdən və dolanacağımızdan yazıb, bəzi mətləblərdən bəhs etmişdik.* F.Köçərli. [Mirzə Əli Əkbər Səttarxana:] *Deyirdin ruznamə çıxardaq, bu da ruznamə.* P.Makulu.

**RUZNAMƏÇİ** *köhn.* b a x **qəzetçi**.

**RUZNAMƏÇİLİK** *köhn.* b a x **qəzetçilik**.

**RÜB** *is.* [*ər.*] 1. Dörddə bir; ilin dörddə bir hissəsi; üçaylıq, kvartal. *Üçüncü rübü tamamlayan bu ay sənaye müəssisəsində ilin axırına necə çıxacağını çox aydın göstərə bilər.* Ə.Sadıq.

2. Bir saatın dörddə bir hissəsinə (15 dəqiqəyə) bərabər vaxt ölçüsü (bəzən "də-

qiqə", "vaxt" mənasında işlənmişdir). *Saat on iki tamamda biz mənzilimizdən çıxdıq. On ikidən bir rüb keçəndə qapını itələdik, açılmadı.* M.İbrahimov.

**RÜBAB** *is.* [*ər.*] Bir çox Şərq xalqları arasında geniş yayılmış simli musiqi aləti. *Rübabın incə tellərdir, .. min aləm var təranəndə.* S.Vurğun. *Sən də alıb ələ bir qızıl rübab; İncə tellərini səsləndir, ay qız.* M.Müşfiq. // *məc. şair.* Şairin ilham, yaradıcılıq mənbəyi, simvolu kimi işlənir. *O indi susursa, inan qırılar; Şeir rübabının ən şaqraq simi.* Ə.Cəmil. *Xəyala hökm edən bu təntənədən; Şeir rübabımı dindirərəm mən.* H.Arif.

**RÜBABÇI** *is.* Rübab çalan. *Rübabçı qızlar ansamblı.*

**RÜBAİ** *is.* [*ər.*] Quruluşca dörd misradan ibarət olub, birinci, ikinci və dördüncü misraları həmqafiyə, üçüncü misrası isə sərbəst qalan dörd misralıq mənzum əsər. *Ömər Xəyyamın rübailəri. Məhsəti xanım Gəncəvinin rübailəri. – Pəncərədən eşidilən rübai küçədə duranlar tərəfindən böyük bir maraqla qarşılandı.* M.S.Ordubadi.

**RÜBƏND** *is.* [*fars.*] *köhn.* Üz örtüyü (qadınlarda). *Məni qoca gördü, rübəndin açdı; Ala gözlərinə gözüm sataşdı.* Aşıq Ələsgər. *Axırda Minnət xanım rübəndini açıb Mərcanın üzünə baxır.* Ü.Hacıbəyov. // *məc.* Təşbehlərdə: örtü, pərdə mənasında. *Rübənd tut üzə, dağlar; Gəlməsin gözə dağlar.* (Bayatı). *Təbiət bürünür ağ rübəndinə; Dağların əhvalı pozulur yenə.* S.Vurğun. *Yatağından dirçəlməmiş Şahtaxtı kəndi; Gərilmiş hər pəncərəyə uyqu rübəndi.* M.Müşfiq.

**RÜBƏNDLİ** *sif.* Üzündə rübənd olan, üzünə rübənd taxmış. *Rübəndli qadın. – Minnət xanım üzü rübəndli gəlib ortada durur.* Ü.Hacıbəyov. *Kənardakı hovuzun yanında .. ağ rübəndli bir qadın durub, gözlərini məscidin qapılarına dikmişdi.* Çəmənzəminli.

**RÜBLÜK** *sif.* Bir rüb (1-ci mənada) üçün nəzərdə tutulmuş, bir rübdə görülən, bir rüb davam edən, bir rübdə başa gələn. *Rüblük plan. Rüblük gəlir.*

**RÜCU** *is.* [*ər.*] *klas.* Geri dönmə, qayıtma, ricət (etmə). ☐ **Rücu etmək** – 1) müraciət etmək. [Nəsir Fərraş:] *Şahzadə buyurdu ki, bu axşam bir mənim hüzuruma gəlsin ki, bir vacib işim var, ona rücu edəcəyəm!* M.F.Axundzadə. *Amma yaxşı olardı ki, hər məsələnin həlli üçün qazı cənablarına, yaxud Şeyx Nəsrullaha rücu edəydiniz, çünki elmdə mənim o qədər qüvvətim yoxdur.* E.Sultanov. *Naməlsəm məhəlləsi yenə Əliyə rücu etdilər.* N.Nərimanov; 2) qayıtmaq. *İndi məqalənin baş mətləbinə rücu edib deyə bilərik ki, mərəzlərimiz çox isə də, onların ümdəsi və mühliki cəhalət və nadanlıqdır.* F.Köçərli; 3) geri dönmək (yoldan); geri almaq, geri götürmək (sözünü).

**RÜFƏQA** *is.* [*ər.* "rəfiq" söz. cəmi] Rəfiqlər, yoldaşlar, dostlar. *İndi məni hər kəs görər olsa rüfəqadan.* M.P.Vaqif.

**RÜFƏT** *is.* [*ər.*] Yüksəklik, böyük rütbə.

**RÜX** *is.* [*fars.*] *klas.* Yanaq, üz.

**RÜXSAR** *is.* [*fars.*] *klas.* Üz, çöhrə. *Canımı yandırdı hicr, ey atəşin rüxsar, eşit!* Qövsi. *Firqətindən yarpaq kimi əsirəm; Rüxsarımı eynim yaşı yandırar.* Aşıq Ələsgər. *Mən bir ucaboylu gözəlin zülfünə bəndəm; Rüxsarı gözəl, şivəsi, rəftarı gözəldir.* Ə.Vahid.

**RÜKƏT** *is.* [*ər.*] *din.* Namazda bir qiyam (ayağa qalxma) ilə bir rüku (əyilmə) və iki səcdədən ibarət hərəkət. *Bir gün Şibli iki rükət namaz qılmaq və bir az dincəlmək üçün məscidə gedir.* "Qabusnamə".

**RÜKN** *is.* [*ər.*] 1. Bir şeyin ən sağlam və möhkəm tərəfi; təməl, dirək, istinadgah. // Məc. mənada. *Ənənə cəmiyyətin rüknüdür.* Çəmənzəminli.

2. *məch.* Bir cəmiyyətin əhəmiyyətli, ən qüvvətli və etibarlı şəxsiyyətlərindən hər biri. [Mədinə Vaqifə:] *Şair, .. xanlığın müşaviri, dövlətin rüknü olan bir adamdan bu sözləri eşitmək?..* Çəmənzəminli.

**RÜKU** *is.* [*ər.*] *din.* Namazda əlləri dizlərə dayayıb əyilmə hərəkəti. *Qünut, rükum, bir də səcdəm səhv olsa; Neyləsəm, səhihdi namazım mənim.* Aşıq Ələsgər.

**RÜMUZ** *is.* [*ər.* "rəmz" söz. cəmi] *klas.* b a x **rəmz**. *Nalə çəkib bülbül dedi: – Ey pəsər; Rümuzi-eşqidən olan bixəbər.* Q.Zakir. [Qasım] *toyun bütün mənasını daşıyan*

*bir rümuz idi: musiqi qədər şən, nəşə kimi cazibəli idi*. Çəmənzəminli.

**RÜSXƏT** [*ər.*] İzin, icazə. *Rüsxət istəmək.* ☐ **Rüsxət almaq** – icazə almaq, izin almaq. [Hacı Kərim] *Kəldəkli Molla İbrahim Xəlil, deyirlər ki, Tiflisə gedib, rüsxət alıb, gəlib, Xaçmazın dağlarında çadır qurub kimya qayırır.* M.F.Axundzadə. [Hümmət Yusifə:] *Əgər könlündən sədr olmaq keçirsə, yuxarıdan rüsxət al, gəl əyləş.* B.Bayramov. **Rüsxət vermək** – icazə vermək, izin vermək.

**RÜSXƏTNAMƏ** *is.* [*ər.* rüsxət və *fars.* ...namə] Rüsxət vərəqəsi; icazənamə.

**RÜSUM[1]** *is.* [*ər.* "rəsm" söz. cəmi] Gətirilən və çıxarılan mallardan və s.-dən alınan dövlət vergisi; rüsumat. *Gömrük rüsumu.* // Dövlət tərəfindən tənzim edilən bəzi əməliyyat üçün alınan pul. *Pasportu qeydetmə rüsumu. Gerb rüsumu.*

**RÜSUM[2]** *is.* [*ər.*] b a x **rəsm** 2-ci mənada. *Ancaq bu qudalıq rüsumunun başqa bir mənası nəzərdə tutulurdu*. R.Əfəndiyev.

**RÜSUMAT** *is.* [*ər.* "rüsum" söz. cəmi] b a x **rüsum[1]**. *Hələ İrana girdikləri dünəndir, gömrük rüsumatını tamamilə ləğv etmişlər.* M.S.Ordubadi.

**RÜSVA(Y)** *is.* 1. Biabır olma, abırsızlıq, heysiyyətdən düşmə, abırdan düşmə. *Nə çəmən cümlə cahandır məni-rüsvayə qəfəs.* S.Ə.Şirvani. // *klas*. Bu sözlə bağlı olan birləşmələrin birinci tərkib hissəsi; məs.: rüsvayi-dünya, rüsvayi-eşq, rüsvayi-xəlq. *Axır elə oldum rüsvayi-aləm; Düşmən tənə eylər, dost qınar məni*. Q.Zakir. ☐ **Rüsva(y) etmək (eləmək)** – abırdan salmaq, adını ləkələmək, biabır etmək (eləmək). [Əsli:] *Nə gəzirsən məlul-məlul bu yerdə; Aman Kərəm, məni rüsvay eyləmə!* "Əsli və Kərəm". [Saray qızları:] *Sevda?! Bu nədir, Sevda?! Etdin bizi sən rüsva.* H.Cavid. [Seyfəli:] *Allah sizi kəssin, bizi el içində .. rüsvay elədiniz!* B.Bayramov. **Rüsva(y) olmaq** – biabır olmaq, heysiyyətdən düşmək, şərəfini itirmək, abırdan düşmək, adı ləkələnmək. [Ağa Mərdan:] *Bir az ürəkli olsun, yoxsa mürafiə vaxtında, qorxuram, iqrara qadir olmuya, rüsva olaq!* M.F.Axundzadə. *Bir dərd əhli heç tapmadım burada; Nahaq yerə rüsvay oldum arada.* Molla Cuma. [Yaxşı:] *Mən bütün dünyada rüsvay olaram.* C.Cabbarlı. **Rüsvayi-aləm (cahan) etmək (eləmək)** – cəmiyyət içərisində adını batırmaq, hörmətdən salmaq, biabır eləmək. **Rüsvayi-aləm (cahan) olmaq** – b a x **rüsva(y) olmaq**. *Mən belə rüsvayi-cahan olduğumu bilməzdim.* Mir Cəlal.

**RÜSVAYÇI** *sif.* Rüsvay edən, abırdan salan, adbatıran, utanılacaq, biabırçı.

**RÜSVAYÇILIQ** *is.* Rüsvayedici iş, hərəkət, hal; rəzalət, biabırçılıq; eyib gətirən şey. [Qadın:] *Nə istəyirsən istə, məni bu rüsvayçılıqdan qurtar!* M.S.Ordubadi. *Sədəf ölümə razı olar, ancaq rüsvayçılığa yol verməz*. M.Hüseyn.

**RÜSVAYEDİCİ** *sif.* Eyib gətirən, ləkələndirən, adbatıran, etibardan salan, utanılacaq. *Rüsvayedici hərəkət*.

**RÜSVA(Y)LIQ** b a x **rüsvayçılıq**. *Bu rüsvalıq mənə səndən degil, badi-səbadəndir*. Füzuli. *Xublar eşqində gör şimdi mənim rüsvalığım; Qisseyi-Fərhad ilə Məcnunu bir əfsanə tut.* S.Ə.Şirvani. [Kərim:] *Mən bacımın rüsvaylığını yerdə qoysam, gərək başıma papaq geyməyib, ləçək geyim.* Ə.Haqverdiyev.

**RÜŞDİYYƏ** *is.* [*ər.*] Keçmişdə: uşaqların ibtidai məktəbi bitirdikdən sonra təhsil aldıqları məktəbin adı.

**RÜŞEYM** [*ər.*] 1. *biol*. İnsan və heyvan embrionu (mayası). *Döllənmiş yumurta hüceyrəsindən rüşeym əmələ gəlir*.

2. *biol*. Toxumun içində hüceyrədən törəmiş yeni bitki mayası. *Qarğıdalı dəninin rüşeymi. Ləpə rüşeymi.*

3. *məc.* Bir şeyin başlanğıc, ibtidai halı. ☐ **Rüşeym halında** – lap başlanğıcında, təzəcə əmələ gəlməyə başladığı anda.

**RÜŞVƏT** *is.* [*ər.*] Öz xeyrinə olaraq bir iş gördürmək xatirinə hər hansı bir vəzifəli şəxsə verilən pul və ya şey. *Rüşvət vermək. – Yalan deyən, rüşvət alan, tərəf tutan, üz görən! Dərdimizə qalmayanlar çıxsın bizim cərgədən!* S.Vurğun. *Bundan sonra kişi pristava, yasavula qızılların bahası qədər rüşvət verdikdən sonra malı əlinə gələrdi*. H.Sarabski.

**RÜŞVƏTXOR, RÜŞVƏTÇİ** *sif.* [*ər.* rüşvət və *fars.* ...xor] Rüşvət alan. *Rüşvətxor adam. – Mənə desəydilər ki, .. Yer üzündə*

*bir rüşvətxor çinovnik yoxdur, inanardım.* Ə.Haqverdiyev. // İs. mənasında. *..Çarın bu mahir rüşvətxoru özünün həyasızlığı ilə Təbriz tacirlərinin arasında zərbi-məsəl olmuşdu.* M.S.Ordubadi. *Yeni ildə heç kəsə; Üz verməsin kədər, qəm; Rüşvətxordan savayı!* R.Rza.

**RÜŞVƏTXORLUQ, RÜŞVƏTÇİLİK** *is*. Rüşvət alıb iş düzəltmə. *Rüşvətxorluqla mübarizə. Rüşvətxorluq ən ağır cinayətdir. – Kiminin rüşvətxorluğu, qohumbazlığı; kiminin xəsisliyi, bəzisinin nadanlığı tənqid olunurdu*. Mir Cəlal.

**RÜTBƏ** *is.* [*ər.*] 1. Xidməti dərəcə, ad. *Zabitlik rütbəsi*. – [Qorxmaz] *sıravilikdən starşinalıq rütbəsinə qalxmışdı.* Ə.Vəliyev. *İndi o, hərbi qiyafədə serjant rütbəsində bir şəfqət bacısı idi.* Ə.Məmmədxanlı.

2. Vəzifə, mövqe, mərtəbə. *Mənim nə rütbəm var, nə də mədənim; Kim olsa yaşatmaq borcumdur mənim*. S.Vurğun. *Çox şey Vətənsiz də yaşayır, ancaq; Şeirsə Vətənsiz, elsiz yaşamaz... Şairə vəzifə, rütbə nə gərək!* B.Vahabzadə.

3. *məc. klas.* Mövqe, dərəcə, mərtəbə. *Seyyida, sal boynuna zünnari-zülfi-yarı sən; Eşqdə gər rütbeyi-Sənanə eylərsən həvəs*. S.Ə.Şirvani.

**RÜTBƏLİ** *sif.* Rütbəsi olan, müəyyən rütbə sahibi olan. *Əbülfət mirzə qapını açan kimi qarşısında böyük rütbəli bir İran məmurunu və iki nəfər də polis nəfərini gördü.* M.S.Ordubadi. *Hacı böyük rütbəli adamlarla oturub-durduğu kimi xırda-xuruş müəllimlərlə də söhbətdən xoşlanır*. Qantəmir.

**RÜTBƏSİZ** *sif.* Rütbəsi olmayan. *Gör hökm-fərmanlar necə güclənib? Ölüm də rütbəsiz, çinsiz qalmadı!* M.Araz.

**RÜTBƏSİZLİK** *is.* Heç bir rütbəsi, vəzifəsi, mövqeyi olmama. *O, ömrünün bu çağında qulluqsuzluğun, rütbəsizliyin necə yaman dərd olduğunu bir daha duyub, koramal kimi qıvrıldı*. S.Rəhimov.

**RÜTUBƏT** *is.* [*ər.*] Yaşlıq, nəmlik, islaqlıq. *Bitki rütubəti sevir. Havada rütubət var. – Yağışın rütubəti səqfin uçan yerindən çəkilməmişdi.* C.Məmmədquluzadə. *Qurbanlı içəri girdi və qapını örtərkən içəridə onu rütubət iyi vurdu.* Çəmənzəminli.

**RÜTUBƏTLƏNMƏK** *f.* Rütubətli olmaq, nəm çəkmək, nəmlənmək. *Otağın divarları rütubətlənib*.

**RÜTUBƏTLİ** *sif.* Rütubəti olan, yaş, islaq, nəm. *Rütubətli torpaq. Rütubətli ev. – Payızın rütubətli havaları başlanmış olduğundan soyuqluq hiss olunurdu.* T.Ş.Simurq. *Tropik aranlara məxsus boğucu, rütubətli, fəqət aydınlıq bir gecə...* H.Nəzərli.

**RÜTUBƏTLİLİK** *is.* Rütubətli şeyin halı; nəmlik, yaşlıq, islaqlıq. *Torpağın rütubətliliyi. Havanın rütubətliliyi.*

Buraxılışa məsul: *Əziz Güləliyev*

Texniki redaktor: *Rövşən Ağayev*

Kompyuter səhifələyicisi: *Ələkbər Kərimov*
*Rəvan Mürsəlov*

Korrektorlar: *Pərinaz Musaqızı*
*Fəridə Səmədova*

Yığılmağa verilmişdir 08.07.2005. Çapa imzalanmışdır 11.08.2006.
Formatı 60x90 $^{1}/_{16}$. Fiziki çap vərəqi 42. Ofset çap üsulu.
Tirajı 25000. Sifariş 173.

DÜST 5773-90, DÜST 4.482-87

CBS POLYGRAPHIC PRODUCTION
Tel/Fax: 447 75 04, Tel.: 447 75 05

Kitab "CBS-PP" MMC mətbəəsində çap olunmuşdur.
Bakı, Şərifzadə küçəsi, 3.